Fars dilindən tərcümə və şərhlər:

AMEA-nın müxbir üzvü, tarix elmləri doktoru, professor
**Oqtay Əfəndiyev**

tarix üzrə fəlsəfə doktoru, dosent
**Namiq Musalı**

**Həsən bəy Rumlu. Əhsənüt-təvarix (Tarixlərin ən yaxşısı). Kastamonu: Uzanlar, 2017, 661 s.**

XVI əsrin görkəmli Azərbaycan tarixçisi Həsən bəy Rumlunun farsca yazdığı “Əhsənüt-təvarix” əsəri-nin son iki cildi zamanımıza qədər gəlib çatmışdır. İstər vətənimizin, istərsə də bir sıra yaxın və uzaq ölkələ-rin XV-XVI əsrlər tarixini öyrənmək baxımından böyük əhəmiyyət daşıyan bu salnamə ilk dəfədir ki, tam şəkildə Azərbaycan dilinə tərcümə edilir. Əsərin zamanımıza çatmış cildlərinin birincisində hicri 807-899-cu (miladi 1404-1494) illərin, ikincisində isə hicri 900-985-ci (miladi 1494-1578) illərin tarixi hadisələri əksini tapmışdır. Hər iki cildin tərcüməsi eyni kitab daxilində oxuculara təqdim edilir. Tərcümə zamanı mənbənin Baroda və Tehran nəşrləri ilə yanaşı Bakıda, AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda mü-hafizə edilən iki əlyazma nüsxəsindən də istifadə olunmuşdur.

BASKI SAYISI: 1
BASKI ADEDİ: 200
BASIM TARİHİ: ŞUBAT 2017
BASIM YERİ KASTAMONU

UZANLAR KOPYALAMA MERKEZİ
İnönü Mahallesi A. Türkeş Bulvarı Yıldız Apt. Altı No: 2/1
Merkez / Kastamonu - Tel: 0366 214 11 94

**MÜNDƏRİCAT**

## GİRİŞ

**Azərbaycanın XV-XVI əsrlər tarixinə dair qaynaqların respublikamızda tərcüməsi, nəşri və tədqiqi.** XV-XVI əsrlər Azərbaycanın orta əsrlər tarixində mühüm bir mərhələni təşkil etmişdir. Bu mərhələ Qaraqoyunlu, Ağqoyunlu, Şirvanşahlar və Səfəvilər dövlətlərinin timsalında klassik dövlətçilik ənənələrimizin uğurlu bir şəkildə davamı və inkişafı, milli ədəbiyyatımızın və mədəniyyətimizin yüksəlişi ilə xarakterizə olunur. Sözügedən dövrdə ölkəmizin beynəlxalq siyasi, iqtisadi və mədəni əlaqələri genişlənir, Azərbaycan tarixi ilə bağlı məlumat verən mənbələrin sayı və çeşidi artırdı. Elə buna görə də XV-XVI əsrlər tariximizə dair qaynaqların öyrənilməsi xüsusi əhəmiyyət daşıyır.

Azərbaycan alimləri XV-XVI əsrlərə dair tarixi qaynaqların tərcüməsi, nəşri və tədqiqi istiqamətində xeyli işlər görmüşlər. Tariximizin bu dövrü ilə bağlı önəmli qaynaqlardan sayılan bir sıra Ağqoyunlu və Səfəvi mənbələri fars dilindən tərcümə edilərək nəşr olunmuşdur. Ağqoyunlu Uzun Həsənin saray tarixçisi Əbu-Bəkr Tehraninin "Kitabi-Diyarbəkriyyə" əsəri R.Şükürova tərəfindən Azərbaycan dilinə çevrilmiş[1], Ağqoyunlu Sultan Yaqubun saray tarixçisi Fəzlullah ibn Ruzbehan Xuncinin "Tarixi-aləmarayi-Əmini" əsəri isə Z.Bünyadovun və O.Əfəndiyevin redaktəsi ilə rus dilində çap edilmişdir[2]. Səfəvi müəlliflərindən Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazinin ümumi tarix haqqında yazdığı "Təkmilətül-əxbar" əsərinin I Şah İsmayılın tarixinə aid hissəsi O.Əfəndiyev tərəfindən rus dilinə[3], eyni əsərin I Şah İsmayıl və I Şah Təhmasibə aid hissələri isə Ə.Rəhimov tərəfindən Azərbaycan dilinə tərcümə edilmişdir[4]. I Şah Təhmasibin xatirələrini əhatə edən və "Şah Təhmasibin təzkirəsi" adlanan əsəri də Ə.Rəhimov Azərbaycan dilinə çevirmişdir[5]. I Şah Abbas dövründə, XVI əsrin sonu – XVII əsrin əvvəllərində qələmə alınan və qızılbaş tayfalarının, onların məşhur əmirlərinin haqqında məlumat verən "Qızılbaşlar tarixi" adlı anonim mənbə M.Məhəmmədi tərəfindən doğma dilimizə qazandırılmışdır[6].

I Şah Abbasın məşhur saray tarixçisi İsgəndər bəy Münşinin üç cildlik "Tarixi-aləmarayi-Abbasi" əsərinin əsasən XVI əsr hadisələrindən bəhs edən ilk cildini mərhum ustadım O.Əfəndiyevlə birlikdə ilk dəfə olaraq Azərbaycan dilinə tərcümə edib yayınlamışıq[7]. Mənbənin Tehrandakı "Əmiri-Kəbir" nəşriyyatında işıq üzü görmüş mətni naqis olduğu üçün bu tərcümə zamanı əsərin Tehran çapı ilə kifayətlənməyərək, AMEA M.Füzuli adına Əlyazmalar İnstitutunda saxlanan üç əlyazma nüsxəsindən də yararlanmışıq və Tehran çapının təxminən 225 yerindəki boşluqları, çatışmazlıqları və yanlışlıqları Bakı nüsxələrinin köməyi ilə təshih etmişik[8]. Bizim tərcüməmiz işıq üzü gördükdən təxminən iki il sonra Y.Mahmudov və Ş.Fərzəliyev də Tehran nəşri əsasında eyni əsərin birinci cildini və ikinci cildin ilk hissələrinin tərcüməsini çap etdirmişlər[9].

Bu mərhələyə dair farsdilli mənbələr üzərində tədqiqatlara gəlincə, O.Əfəndiyev[10], C.İbrahimov[11], S.Onullahi[12], M.Heydərov[13], M.Abbaslı[14], S.Aşurbəyli[15] və digərləri bu yöndə apardıqları araşdırmalarla və-

---

[1] *Əbu-Bəkr Tehrani. Kitabi-Diyarbəkriyyə (Həsən bəy Ağqoyunlunun, onun sələflərinin tarixi və Qaraqoyunlu və Cığatay tarixindən ona aid olanlar). Fars dilindən tərcümə edən, ön söz, şərhlər və göstəricilərin müəllifi: R.Şükürova. Bakı: Elm, 1998, 336 s.*

[2] *Фазлуллах ибн-Рузбихан Хунджи. Тарих-и алам ара-йи Амини (под редакцией З.М.Буниятова и О.А.Эфендиева). Баку: Элм, 1987, 172 с.*

[3] *О.А.Эфендиев. Образование Азербайджанского государства Сефевидов в начале XVI века. Баку: Издательство АН Азерб.ССР, 1961, с.143-165.*

[4] *Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazi. Təkmilətül-əxbar (Səfəvi dövrü – Şah İsmayıl və Şah Təhmasib dövrlərinin tarixi). Fars dilindən tərcümə, müqəddimə və şərhlər: Ə.Rəhimli. Bakı: Elm, 1996, 198 s.*

[5] *Şah Təhmasibin təzkirəsi (fars dilindən tərcümə və müqəddimə Ə.Rəhimovundur). Bakı: Azərnəşr, 1996, 128 s.*

[6] *Qızılbaşlar tarixi ("Tarix-e qezelbaşan"). Fars dilindən tərcümə və şərhlər M.Məhəmmədinindir. Bakı: Azərnəşr, 1993, 48 s.*

[7] *İsgəndər bəy Münşi Türkman. Tarix-i aləmara-yi Abbasi. I cild. Farscadan tərcümənin, ön sözün, şərhlərin və göstəricilərin müəllifləri: O.Ə.Əfəndiyev və N.S.Musalı. Bakı: Təhsil, 2009, 792 s.*

[8] Daha ətraflı bax: *O.Efendiyev, N.Musalı. Târîh-i 'Âlem Ârâ-yi 'Abbasî isimli eserin Bakü yazmalarının önemine dair // Safevîler ve Şah İsmail. İstanbul: Önsöz Yayıncılık, 2014, s.117-160.*

[9] *İsgəndər bəy Münşi Türkman. Dünyanı bəzəyən Abbasın tarixi (Layihənin rəhbəri, redaktor və ön sözün müəllifi: Y.Mahmudov; Fars dilindən çevirən: Ş.Fərzəliyev). Bakı: Şərq-Qərb, 2011, 1144 s.* Qeyd edək ki, 2015-ci ildə həmin tərcümənin ardı olan ikinci kitab da işıq üzü görmüşdür.

[10] *О.А.Эфендиев. Образование азербайджанского государства Сефевидов в начале XVI века. Баку: Издательство АН Азерб. ССР, 1961; О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке. Баку: Элм, 1981.*

[11] *Дж.М.Ибрагимов. Феодальные государства на территории Азербайджана XV века. Баку: Издательство АПИ, 1962.*

[12] *S.M.Onullahi. XIII-XVII əsrlərdə Təbriz şəhəri (sosial-iqtisadi tarixi). Bakı: Elm, 1982.*

tən tarixşünaslığına böyük töhfələr vermişlər. Əbu-Bəkr Tehraninin "Kitabi-Diyarbəkriyyə" əsəri R.Şükürova[16], Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri Ş.Fərzəliyev[17], Qazı Əhməd Quminin "Xülasətüt-təvarix" əsəri Ş.Məmmədova[18], İsgəndər bəy Münşinin "Tarixi-aləmarayi-Abbasi" əsəri Ə.Rəhmani[19], anonim müəllifin "Tarixi-aləmarayi-Şah İsmayıl" əsəri isə bu sətirlərin müəllifi tərəfindən Azərbaycan tarixinin mənbəyi kimi monoqrafik şəkildə öyrənilmişdir[20]. Bundan əlavə, Z.Bayramlının[21], R.Ağayevin[22] və digərlərinin farsdilli qaynaqlar üzərində apardıqları araşdırmalar diqqəti cəlb edir. M.Nemətova[23] dövrün epiqrafik, Ə.Rəcəbli[24] isə numizmatik mənbələri üzərində dəyərli tədqiqatlar aparmışlar. Səfəvilər dövründə Azərbaycanda tarixçiliyin inkişafı məsələləri X.Qasımovun monoqrafiyasında təhlil edilmişdir[25]. Farsdilli sənədlərin nəşri, tərcüməsi və tədqiqi sahəsində T.Musəvinin[26], epistolyar isrin tərcüməsi və araşdırılması üzrə Ş.Fərzəliyevin[27], A.Fərzəliyevin və R.Məmmədovanın[28], türkdilli sənədlərin və məktubların öyrənilməsi istiqamətində S.Onullahinin və A.Həsənovun[29] xüsusi xidmətləri vardır. Son illərdə Şah İsmayıla aid tarixi-diplomatik sənədlər toplusunun nəşr edilməsi də bu yöndə atılmış mühüm addımlardan biridir[30].

Müvafiq dövrə dair Osmanlı mənbələrinin tariximizə aid hissələrinin tərcüməsi və nəşri sahəsində mərhum akad. Z.Bünyadovun diqqətəlayiq fəaliyyətləri olmuşdur[31]. 1578-1590-cı illər Səfəvi – Osmanlı müharibəsi haqqında ən mühüm mənbələrdən olan İbrahim Rəhimizadənin əsərləri F.Hüseyn tərəfindən tədqiq edilərək rus dilinə[32], R.Şeyxzamanlı tərəfindən də Azərbaycan dilinə[33] tərcümə edilmişdir. XV-XVI əsrlərə aid Osmanlı qaynaqlarının tədqiqi baxımdan Ş.Fərzəliyevin, Ş.Mustafayevin, T.Nəcəflinin, T.Cəfiyevin, C.İsmayılın və digərlərinin apardıqları araşdırmalar diqqəti cəlb edir[34]. Səfəvi dövlətinin yaranmasından və

---

[13] *М.Х.Гейдаров. Города и городское ремесло Азербайджана в XIII – XVII вв. Баку: Элм, 1982; М.Х.Гейдаров. Социально-экономические отношения и ремесленные организации в городах Азербайджана в XIII-XVII вв. Баку: Элм, 1987; М..Х.Гейдаров. Торговля и торговые связи Азербайджана в позднем средневековье. Баку: Элм, 1999.*

[14] *M.Abbaslı. Şah İsmayıl Xətainin ömür yolu miniatürlərdə. Bakı: İşıq, 1981.*

[15] *С.Б.Ашурбейли. История города Баку (период средневековья). Баку: Азернешр, 1992; S.B.Aşurbəyli. Şirvanşahlar dövləti (VI-XVI əsrlər). Bakı: Avrasiya-Press, 2006.*

[16] *R.Şükürova. Əbu Bəkr Tehrani və onun "Kitab-i Diyarbəkriyyə" əsəri. İstanbul: Bayrak, 2006.*

[17] *Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə (Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri üzrə). Bakı: Elm, 1983.*

[18] *Ş.K.Məmmədova. "Xülasət ət-təvarix" Azərbaycan tarixinin mənbəyi kimi. Bakı: Elm, 1991.*

[19] *А.А.Рахмани. «Тарих-и алам ара-йи Аббаси» как источник по истории Азербайджана. Баку: Издательство АН Азерб. ССР, 1960.*

[20] *N.S.Musalı. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında). Bakı: Elm və Təhsil, 2011.*

[21] *Z.H.Bayramlı. Azərbaycan Səfəvilər dövlətinin quruluşu və idarə sistemi. Bakı: ADPU nəşriyyatı, 2006; yenə onun: Azərbaycan Səfəvi dövlətinin quruluşu və idarə olunmasında türk qızılbaş əyanlarının rolu. Bakı: Avropa nəşriyyatı, 2015.*

[22] *R.Ə.Ağayev. Azərbaycan və Mərkəzi Asiya dövlətlərinin qarşılıqlı münasibətləri (XV-XVI əsrlər). Bakı: Kür, 2004.*

[23] *M.S.Nemətova. XIV-XVI əsr Şirvan tarixinin öyrənilməsinə dair (Epiqrafik abidələr əsasında) Bakı: Elm, 1959; М.С.Нейматова. Мемориальные памятники Азербайджана (XII-XIX вв.). Баку: Элм, 1981.*

[24] *А.М.Раджабли. Монетное дело в Сефевидском государстве (XVI – начало XVIII вв.). Автореферат диссертации на соискание ученой степени кандидата исторических наук. Баку: Издательство АН Азерб. ССР, 1963.*

[25] *X.S.Qasımov. Orta əsrlərdə Azərbaycan mədəniyyəti. Bakı: Aspoliqraf, 2008, s.296-309.*

[26] *T.M.Musəvi. Orta əsr Azərbaycan tarixinə dair fars dilində yazılmış sənədlər. Bakı: Azərb. SSR EA nəşriyyatı, 1965; T.M.Musəvi. Bakı tarixinə dair orta əsr sənədləri. Bakı: Azərb. SSR EA nəşriyyatı, 1967; T.M.Musəvi. Orta əsr Azərbaycan tarixinə dair farsdilli sənədlər (XVI-XVIII əsrlər). Bakı: Elm, 1977.*

[27] *Ş.F.Fərzəlibəyli. Azərbaycan və Osmanlı imperiyası (XV-XVI əsrlər). Bakı: Azərnəşr, 1995.*

[28] *А.М.Фарзалиев, Р.М.Мамедова. Сефевиды и Великие Моголы в мусульманской дипломатике. Санкт-Петербург: Филологический факультет СПГУ, 2004*

[29] *S.M.Onullahi, A.Q.Həsənov. Səfəvi hökmdarlarının daha iki naməlum məktubu haqqında (Azərbaycan dilində dövlətlərarası yazışma tarixindən) // ADU-nun Elmi əsərləri, tarix və fəlsəfə seriyası, 1974, No.4; S.M.Onullahi, A.Q.Həsənov. Qaraqoyunluların, Səfəvi hökmdarları və türk sultanlarının azərbaycanca beş yeni sənədi haqqında // ADU-nun Elmi əsərləri, tarix və fəlsəfə seriyası, 1977, No. 1; S.M.Onullahi. Azərbaycan dilində daha dörd sənəd // "Ədəbiyyat və incəsənət" qəzeti, 22.06.1990.*

[30] *Şah İsmayıl Səfəvi. Tarixi-diplomatik sənədlər toplusu. Bakı: Şərq-Qərb, 2014.*

[31] *Печеви Ибрахим Эфенди. История (Извлечения по истории Азербайджана и сопредельных стран и областей периода 1520-1640 гг.). Перевод с турецкого языка и примечания З.М.Буниятова. Баку: Элм, 1988; Solakzadə Mehmed. Tarix: Azərbaycan tarixinə dair iqtibaslar (türk dilindən tərcümə edəni: Z.Bünyadov). Bakı: Elm, 1992; Selaniki Mustafa Əfəndi. Tarixi-Selaniki (1563-1600-cü illər). Azərbaycan və qonşu ölkələrin tarixinə dair iqtibaslar (Osmanlı dilindən tərcümə edəni: Z.Bünyadov). Bakı: Elm, 1992.*

[32] *Ф.А.Гусейн. Османо – сефевидская война 1578-1590 гг. (по материалам трудов османского летописца Ибрахима Рахимизаде). Баку: Нурлан, 2005.*

[33] *İbrahim Rəhimizadə Hərimi. Osmanlı qoşunlarının Azərbaycana yürüşləri (XVI əsrin sonu). Nəşrə hazırlayan, ön sözün və şərhlərin müəllifi: R.Şeyxzamanlı. Bakı: Nurlan, 2007.*

[34] *Ş.F.Fərzəlibəyli. Azərbaycan və Osmanlı imperiyası (XV-XVI əsrlər). Bakı: Azərnəşr, 1995; Ш.М.Мустафаев. Восточная Анатолия: от Ак-коюнлу к Османской империи. Москва: Востлит, 1994; T.H.Nəcəfli. Azərbaycan Qaraqoyunlu və Ağqoyunlu döv-*

ilk dövründən bəhs edən "Zühuri-dövləti-Səfəviyan" ("Səfəvilər dövlətinin meydana gəlməsi") adlı Osmanlı türkcəsində bir əsər əlyazma halında Ankara Milli Kitabxanasında tərəfimizdən aşkarlanaraq çap edilmişdir[35].

Avropa mənbələrindən bəziləri – "İranlı Don Juan" adı ilə tanınan Səfəvi diplomatı Oruc bəy Bayatın kitabı, Venesiya Respublikasının səfiri kimi Səfəvilər dövlətində olmuş Mikele Membrenin və D`Alessandrinin səyahətnamələri Azərbaycan alimləri tərəfindən tərcümə və nəşr edilmişdir. Bu mənbələrdən birincisi O.Əfəndiyev və A.Fərzəliyev tərəfindən ruscaya[36], digər ikisi isə O.Əfəndiyev tərəfindən həm rus, həm də Azərbaycan dillərinə tərcümə edilmişdir[37]. Avropa mənbələrinin tədqiqi sahəsində Ə.Şahmalıyevin, Y.Mahmudovun, D.Əzimlinin, Ə.Quliyevin və digərlərinin xidmətləri olmuşdur[38].

Erməni mənbələrindən Foma Metsopskinin əsəri Azərbaycan və rus dillərinə tərcümə edilərək eyni kitabda işıq üzü görmüşdür[39]. Respublikamızda müvafiq dövrə dair erməni mənbələrinin tədqiqi ilə S.Məmmədov məşğul olmaqdadır[40].

Azərbaycan tarixinə dair mənbələri ehtiva edən bəzi toplularda da XV-XVI əsr tariximizə dair mənbələrdən tərcümələrə yer verilmişdir[41].

Beləliklə, burada Azərbaycanın XV-XVI əsrlər tarixinə dair müxtəlif səpkili tarixi mənbələrin ölkəmizdə tərcüməsi, nəşri və tədqiqi vəziyyətinə aydınlıq gətirməyə çalışdıq. Bu istiqamətdə xeyli iş görülməsinə baxmayaraq, tərcümə edilməli və araşdırılmalı mənbələrin yetərincə çox olduğunu etiraf etməliyik. Sözügedən dövr üçün ən mühüm qaynaqlardan biri də XVI əsr Azərbaycan tarixçisi Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəridir.

**Həsən bəy Rumlunun həyatı.** 1402-ci ildə Ankara döyüşündə türk dünyasının iki böyük fatehi – Əmir Teymur və İldırım Bayəzid üz-üzə gəlir. Bu mübarizədən qalib çıxan Əmir Teymur o dövrdə daha çox Rum adı ilə tanınan Anadoludan minlərlə türkü əsir alaraq, kölə kimi Orta Asiyaya aparmaq istəyir. Lakin Ərdəbildə Səfəvi şeyxi Xoca Əlini ziyarət edən Əmir Teymur bu əsirləri şeyxin xahişi ilə azad etməli olur. Öz xilaskarlarına minnət duyğusu içində Ərdəbil ocağının müridlərinə çevrilən bu insanların bir qismi Anadoluya dönsə də, bir hissəsi Ərdəbil bölgəsində qalmağı üstün tutur. Ərdəbildə qalan Anadolu (Rum) sufiləri burada "rumlu sufilər" adı ilə məşhurlaşırlar[42]. XV əsrin sonunda Ərdəbil şəhərində onların məskunlaşdığı rumlular məhəlləsi vardı[43].

Rumlu tayfası Azərbaycan Səfəvilər dövlətinin yaranması və möhkəmlənməsi uğrunda gedən mübarizədə aktiv iştirak etmişdir. Şah İsmayılın hakimiyyətə gəlməsinə dəstək verən səkkiz türk qızılbaş tayfasın-

---

*lətləri müasir Türkiyə tarixşünaslığında. Bakı: Çaşıoğlu, 2012; T.H.Nəcəfli. Səfəvi – Osmanlı münasibətləri (Türkiyə tarixşünaslığında). Bakı: Turxan NPB, 2015; T.R.Cəfiyev. Azərbaycan feodal dövlətləri XV-XVI əsrin I rübündə (Xoca Sədəddin Əfəndinin "Tacüt-təvarix" əsəri əsasında). Tarix elmləri namizədi alimlik dərəcəsi almaq üçün təqdim olunan dissertasiyanın avtoreferatı. Bakı: Mars-print, 2007; C.C.İsmayıl. Osmanlı tarixçisi Hüseynin "Bədayə-ül-vəqayə" əsəri Azərbaycan tarixinin mənbəyi kimi (XV-XVI əsrin I yarısı). Tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı. Bakı: AMEA TİKM, 2012; Gəncə-Qarabağ əyalətinin icmal dəftəri (layihənin rəhbəri və ön sözün müəllifi: Y.M.Mahmudov; tərtibçi: T.H.Nəcəfli). Bakı: Çaşıoğlu, 2010; B.Dedeyev. XV. yüzyılın ikinci yarısında Osmanlı Devleti – Azerbaycan ilişkileri. Konya: Selçuk Üniversitesi Sosyal Bilimler Enstitüsü, 2004.*

[35] *Zühuri-dövləti-Səfəviyan (ön söz, transfoneliterasiya, tərcümə, şərhlər və göstəricilər: N.S.Musalı). Bakı: Mütərcim, 2013.*

[36] *Книга Орудж-бека Байата – Дон Жуана Персидского (перевод с английского на русский О.А.Эфендиева и А.М.Фарзалиева). Баку: Язычы, 1988.*

[37] *O.Ə.Əfəndiyev. Venesiyalılar Şah I Təhmasibin sarayında (Mikele Membre ve Vinçenso Alessandri). Bakı: Təhsil, 2005.*

[38] *Э.М.Шахмалиев. Из истории торговой политики европейских держав на Переднем Востоке в XVI в. Автореф. докт. дис. Баку, 1958; Я.М.Махмудов. Взаимоотношения государств Ак-коюнлу и Сефевидов с западно-европейскими странами (вторая половина XV – начало XVII вв.). Баку: Издательство Бакинского Университета, 1991; D.M.Əzimli. Azərbaycanın Qərbi Avropa ölkələri ilə ticarət əlaqələri və Türkiyə (XV əsrin II yarısı – XVII əsrin I yarısı). Tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı. Bakı: AMEA TİKM, 2010; Ə.S.Quliyev. XVI əsrin ortalarında Azərbaycan Səfəvilər dövlətinin ictimai-siyasi vəziyyəti (Mikel Membrenin "Səyahətnamə"si əsasında). Bakı: Şərq-Qərb, 2011.*

[39] *F.Metsopski. Teymurləngin və onun xələflərinin tarixi. Bakı: Azərbaycan SSR EA nəşriyyatı, 1957.*

[40] *С.А.Мамедов. Азербайджан по источникам XV – первой половины XVIII вв. Баку: Элм, 1993.*

[41] *Путешественники об Азербайджане. Т. 1. Составитель З.И.Ямпольский; под ред. Э.М.Шахмалыева. Баку: АН. Азерб.ССР, 1961; Azərbaycan tarixi üzrə qaynaqlar (tərtibatçı və redaktor: S.Əliyarlı). Bakı: Çıraq, 2007.*

[42] *Şeyx Hüseyn pesəri-Abdal Pirzadeyi-Zahidi. Silsilətün-nəsəbi-Səfəviyyə. Berlin, 1343, s.48; О.А.Эфендиев. Азербайджанское государство Сефевидов, с.42; N.S.Musalı. I Şah İsmayılın hakimiyyəti, s.96.*

[43] *Cahangüşayi-xaqan (Tarixi-Şah İsmayıl). Müqəddimə və peyvəstha: A.Müztərr. İslamabad, 1986, s.60; О.А.Эфендиев. Азербайджанское государство Сефевидов, с.44.*

dan biri də məhz rumlular olmuşlar. Səfəvilərin hakimiyyətə yüksəlişindən sonra rumlu tayfasının əmirləri istər mərkəzi dövlət aparatında, istərsə də əyalətlərin idarə olunmasında mühüm rol oynamışlar. Əmirülüməra Div sultan (Əli bəy), Ərzincan hakimi Nurəli xəlifə, Məşhəd hakimi Sufiyan xəlifə, Ərdəbil hakimi Badıncan sultan, Çuxursəəd hakimi Hüseyncan sultan, Xoy hakimi Dəli Budaq, Şirvan hakimi Araz xan, Nişapurda və Gilanda hakimlik etmiş Dərviş Məhəmməd xan və b. bu tayfanın ən görkəmli nümayəndələrindəndirlər. Onu da qeyd etmək yerinə düşər ki, Səfəviyyə təriqətinə bağlı xəlifələrə ümumi rəhbərliyi həyata keçirən xəlifətül-xüləfa mənsəbi uzun müddət rumlu tayfasının təmsilçilərinə məxsus olmuşdur. Rumlu tayfası yalnız idarəçi və hərbçilər deyil, türkcə və farsca şeirlər yazan Şahqulu bəy kimi şair, tərcümə etdiyimiz mənbənin müəllifi olan Həsən bəy kimi tarixçi də yetirmişdir.

"Əhsənüt-təvarix" əsərinin müəllifi Həsən bəy Rumlunun tərcümeyi-halına dair bildiklərimiz əsas etibarilə özü haqqında "Əhsənüt-təvarix"də verdiyi sistemisiz məlumatlardan ibarətdir[44]. O, h. 937 / m. 1530-31-ci ildə İranın Qum şəhərində dünyaya gəlmişdir[45]. Babası Qəzvin və Savucbulaq hakimi olan məşhur qızılbaş sərkərdəsi Əmir sultan Rumludur. Bu səbəbdən Həsən bir müddət tiyul şərti feodal mülkiyyəti formasında babasına məxsus olan Qəzvin şəhərində yaşamışdır. H. 943 / m. 1536-37-ci ildə I Şah İsmayılın oğlu olan Səfəvi şahzadəsi Bəhram mirzə Qəzvinə gələrkən Həsən öz anası ilə birlikdə onu qarşılamış, hədiyyələr təqdim etmişdir[46]. H. 946 / m. 1539-40-cı ildə babası Əmir sultan vəfat etdikdən sonra Həsən bəy şahın şəxsi qvardiyası olan qorçular dəstəsinə cəlb edilir[47]. H. 948 / m. 1541-42-ci ildə Şah Təhmasibin Dizful yürüşünə qoşulan Həsən bəy h. 980 / m. 1572-73-cü ilə kimi şahın bütün səfərlərində onu müşayiət etdiyini bildirir[48]. Müəllif öz əsərində h. 953 / m. 1546-47-ci ildə Gürcüstana, h. 957 / m. 1550-ci ildə Ərdəlan kürdlərinin üzərinə yürüşlərdə iştirakı haqqında xatirələrini bölüşür[49]. Səfəvi dövrünün digər bir azərbaycanlı tarixçisi İsgəndər bəy Münşi isə h. 951 / m. 1544-45-ci ildə Böyük Moğol hökmdarı Hümayun padşahın Şah Təhmasibin hüzuruna gəlməsi zamanı Həsən bəy Rumlunun da orada olduğunu qeyd etmişdir[50].

I Şah Təhmasibin hakimiyyətinin son illərində şahzadələr arasında gələcək hökmdarı müəyyənləşdirməkdən ötrü iqtidar mücadiləsi qızışır. Ustaclu tayfası Heydər mirzəni müdafiə etdiyi halda, bir çox başqa qızılbaş tayfaları şahın digər oğlu İsmayıl mirzəni dəstəkləyirlər. Həsən bəyin də simpatiya bəslədiyi İsmayıl mirzə II Şah İsmayıl (1576-77) adı ilə taxta çıxsa da, onun hakimiyyəti uzun çəkmir. II Şah İsmayılın ölümündən sonra Şah Təhmasibin digər bir oğlu Şah Məhəmməd Xudabəndə (1578-87) hakimiyyətə gəlir. Şah Məhəmməd Xudabəndə hakimlik etdiyi Şiraz şəhərindən paytaxt Qəzvinə doğru yolda olarkən Həsən bəy Qum şəhərində yeni hökmdarın məiyyətinə qoşulmuşdur[51].

Həsən bəy Rumlunun sonrakı taleyi qaranlıqdır. "Əhsənüt-təvarix" Şah Məhəmməd Xudabəndənin hakimiyyəti dövrünün başlanğıcında – 1578-ci ilin hadisələrində yarımçıq qalır. Həmin zaman müəllifin yaşı 48-dən çox deyildi. Ə.Nəvai dövrün keşməkeşli siyasi mənzərəsinin təhlilini apararaq, II Şah İsmayılın qızğın tərəfdarlarından olduğu üçün Həsən bəy Rumlunun Şah Məhəmməd Xudabəndə zamanında arzuolunmaz şəxs kimi həbsə salındığını və hətta ortadan qaldırıldığını ehtimal edir[52].

Həsən bəy Rumlu bir hərbçi olmaqla yanaşı, həm də öz dövrünün ziyalı şəxslərindən idi. O, elm öyrəndiyi müəllimlərindən Mövlana Malik Qəzvininin və Mövlana Əbülhəsən ibn Mövlana Əhməd Bavərdinin adını çəkir və onlar haqqında məlumat verir[53].

---

[44] Bəzi tədqiqatçılar bu məlumatları sistemləşdirməyə təşəbbüs göstərmişlər: *Ə.Nəvai. Müqəddimə // Həsən bəy Rumlu. Əhsənüt-təvarix. Tehran, 1389, s.54-65; Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.7-10; C.N.Seddon. Hasan-i Rumlu's Ahsanu't-tawárikh // Journal of the Royal Asiatic Society of Great Britain and Ireland, No. 2 (Apr., 1927), pp. 307-313; Z.Əliməhəmmədi. Həsən bəy Rumlu: müvərrixi ba mənsəbi-qurçigəri // Nameyi-tarixpəjuhan, 1388 (payiz), No. 19, s.118-141; Z.Hüseynli. Farsça yazan Türk tarihçilerinin Türk tarihine yaklaşımları // I. Uluslararası Türklerde Tarih Bilinci ve Tarih Yazıcılığı Sempozyumu Bildiriler Kitabı. Zonguldak, 2015, s.222-223.*

[45] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix (təshih və təhşiyə: Ə.Nəvai). Tehran, 1389, II c., s.1203.*

[46] *Yenə orada, III c., s.1251.*

[47] *Yenə orada, III c., s.1271-1272.*

[48] *Yenə orada, III c., s.1280.*

[49] *Yenə orada, III c., s.1301,1336-1337.*

[50] *İsgəndər bəy Münşi Türkman. Tarixi-aləmarayi-Abbasi. I c. Bakı, 2009, s.220.*

[51] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, III c., s.1550.*

[52] *Ə.Nəvai. Müqəddimə, s.62-65.*

[53] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, II c., s.1079; III c., s.1414.*

Səlcuqilər zamanından etibarən tarixi əsərlərin yazılmasında fars dili böyük bir əhəmiyyət qazanır və tədricən ərəb dilini ikinci plana sıxışdırmağa nail olur. Artıq XIII əsrin əvvəllərində Hindistandan Anadoluya qədər geniş bir coğrafiyada fars dilində tarixi əsərlər qələmə alınırdı[54]. XI-XIII əsrlərdən başlayaraq XIX əsrədək fars dilinin Ön və Mərkəzi Asiyadakı rolundan bəhs edən İ.P.Petruşevski qeyd edir ki, "təkcə İranda deyil, həm də Rumda (Anadoluda), Azərbaycanda, Orta Asiyada, Şərqi Türküstanda, Hindistanın müsəlman dövlətlərində farsca tarixi əsərlər yazılmaqda idi"[55].

Səfəvilər dövründə fars dilinin istifadə arealının daralmasına və türkcəmizin yazı dili kimi əhəmiyyətinin xeyli dərəcədə artmasına baxmayaraq, tarixi əsərlərin yazılmasında fars dili hələ də öz dominant mövqeyini qoruyub saxlamaqda idi. Bu dövrdə türk dili poeziyada əldə etdiyi nailiyyətləri tarixşünaslıq sahəsində qazana bilməmişdir. Hətta Barxudar bəy Türkman, Həsən bəy Rumlu, İsgəndər bəy Münşi Türkman, Vəliqulu bəy Şamlu, Hacı Məhəmmədqulu xan Qacar kimi türk qızılbaş tayfalarının nümayəndələri də öz tarixi əsərlərini farsca yazmışlar[56]. "Əhsənüt-təvarix" əsərinin müəllifi də bir sıra soydaşları kimi orta əsr ənənələrinə uyğun surətdə öz əsərini farsca qələmə almasına baxmayaraq, bir türk hərbçisi olmuşdur. Bu barədə Ç.N.Seddonun aşağıdakı dəyərləndirməsi xüsusi maraq doğurur: "İran (Səfəvi – N.M.) və Türkiyə (Osmanlı – N.M.) sarayları arasındakı diplomatik yazışmalarda fars dilindən istifadə edilməsinə baxmayaraq, həm şah, həm də sultan, bir qayda olaraq, türkcə danışırdılar. Yəqin ki, Həsən Rumlu da farsca yazmasına baxmayaraq, türkcə danışmışdır. Çünki böyük hərbi başçılar belə edirdilər. Şah Abbas dövrünün fransız səyyahı Andre Daulier-Deslandes belə yazır: "Ölkənin (İranın – N.M.) öz dili var; lakin sarayda və təhsilli adamlar arasında, demək olar ki, həmişə türkcə danışılır"[57].

**"Əhsənüt-təvarix"in strukturu.** "Əhsənüt-təvarix"in neçə cilddən ibarət olması haqqında elmi çevrələrdə uzun müddət mübahisələr getmiş, tədqiqatçılar bu əsərin 10 və ya 12 cild olması haqqında mülahizələr irəli sürmüşlər. Belə bir vəziyyətin yaranmasının əsas səbəbi əsərin yalnız son iki cildinin dövrümüzə qədər gəlib çıxması və bu cildlərdə ziddiyyətli məlumatların yer alması olmuşdur. Belə ki, əsərin B.Dornun kataloquna 287 saylı əlyazma kimi daxil edilmiş Peterburq nüsxəsinə əsaslanan A.A.Romaskeviç "Əhsənüt-təvarix"in 10 cilddən ibarət olduğunu bildirmiş və dövrümüzə gəlib çatan cildlərin IX və X cildlər olduğunu ifadə etmişdir[58]. Lakin "Əhsənüt-təvarix"in Peterburq nüsxəsində əsərin 10 cilddən ibarət olması əksini tapsa da, İran alimi Ə.Nəvainin əsaslandığı nüsxələrdə mənbənin 12 cilddən ibarət olduğu göstərilmişdir. Məsələn, iranlı alimin nəşrə hazırladığı mətnin başlanğıcında belə bir cümlə ilə qarşılaşırıq: "Bu sətirlərin müəllifi və Əmir sultan Rumlunun nəvəsi olan Həsən "Əhsənüt-təvarix"in on birinci cildini başlayır"[59]. "Əhsənüt-təvarix"in İstanbuldakı Nuruosmaniyyə kitabxanasında saxlanan son cildinin sərlövhəsi belədir: "Həsən bəy Rumlunun – Allah onun əhvalını yaxşılaşdırsın – əsəri olan "Əhsənüt-təvarix"in on ikinci cildi"[60]. Eyni zamanda, həmin cildin Tehrandakı İran İslami Şura Məclisində mühafizə edilən əlyazmasının müqəddimə hissəsində belə bir qeydlə rastlaşırıq: "Əhsənüt-təvarix"in on ikinci cildi başladı…"[61]. Bütün bu ziddiyyətli məqamlara baxmayaraq, Azərbaycan tarixçisi Ş.Fərzəliyev apardığı araşdırmalar nəticəsində "Əhsənüt-təvarix"in 10 cilddən ibarət olduğunu dəqiqləşdirmiş və bu barədə əsaslı sübutlar təqdim etmişdir[62].

Bizə gəlib çatan son iki cild XV-XVI əsrlərin tarixini əhatə edir. Əsər salnamə üslubunda yazılmış və xronoloji ardıcıllığa ciddi riayət edilmişdir. Tarixi hadisələr illər üzrə qruplaşdırılmış, hər il baş vermiş əhvalatlar ayrıca fəsillər içində təsvir edilmişdir. Bu fəsillər daxilində ilbəil Azərbaycanda, İraqda, Xorasanda, Mavəraünnəhrdə, İranın müxtəlif vilayətlərində, hətta Hindistanda, Rumda (Anadoluda), Şamda (Suriya-

[54] *В.В.Бартольд. Иран: исторический обзор. Ташкент, 1926, с.70.*

[55] *И.П.Петрушевский. Иранские источники по истории Азербайджана (XVI-XVIII вв.) // Сборник статей по истории Азербайджана. Вып. I. Баку, 1949, с.299.*

[56] *Ч.А.Стори. Персидская литература: био-библиографический обзор в трех частьях (перевел с английского, переработал и дополнил Ю.Э.Брегель). Москва, 1972, с.443,854,859-862,873-883,894.*

[57] *A Chronilcle of the Early Safawis Being the Ahsanu't-Tawarikh of Hasan-i Rumlu. Vol. 2 (English Translation). Translated by C.N.Seddon. Baroda: Oriental Institute, 1934, p. 256-257.*

[58] *А.А.Ромаскевич. Иранские источники по истории туркмен // Материалы по истории туркмен и Туркмении, Том II. XVI-XIX вв. Иранские, бухарские и хивинские источники. Москва – Ленинград, 1938, с.9-10.*

[59] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, s.104.*

[60] Bax: *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, s.899.*

[61] Bax: *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, s.900.*

[62] *Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.11-14.*

da), Misirdə, Firəngistanda (Avropada) belə baş vermiş mühüm hadisələr müxtəlif sərlövhələr altında əksini tapmışdır. Fəsillərin sonunda, bir qayda olaraq, "Müxtəlif əhvalatlar" başlığı altında həmin ilə aid qısa xəbərlər və "Ölümlər" başlığı altında həmin il dünyasını dəyişmiş görkəmli şəxsiyyətlər, məşhur dövlət, mədəniyyət, elm və sənət xadimləri haqqında məlumat verilmişdir. Əsərin mətnində çox sayda "Quran" ayələrinə və şeirlərə rast gəlirik. Lakin farsdilli ədəbiyyatın tanınmış mütəxəssislərindən olan Ə.Nəvai "Əhsənüt-təvarix"də yer verilmiş şeirlərin bir qisminin bayağı və əhəmiyyətsiz olduğunu vurğulayaraq, bu cür nümunələrə yer verdiyi üçün Həsən bəy Rumlunu tənqid etmişdir[63].

Ş.Fərzəliyevin apardığı tədqiqatlar nəticəsində məlum olmuşdur ki, Həsən bəy Rumlu öz əsərini yazarkən Həkiməddin İdris Bitlisinin "Həşt behişt", Əbdürrəzzaq Səmərqəndinin "Mətləüs-səadeyn və məcməül-bəhreyn", Mirxondun "Rövzətüs-səfa", Dövlətşah Səmərqəndinin "Təzkirətüş-şüəra", Əbu-Bəkr Tehraninin "Kitabi-Diyarbəkriyyə", Qiyasəddin Xandəmirin "Həbibüs-siyər", anonim müəllifin[64] "Tarixi-Şah İsmayıl Səfəvi", Fəzlullah ibn Ruzbehan Xuncinin "Tarixi-aləmarayi-Əmini", Qazı Əhməd Qəffarinin "Tarixi-cahanara" əsərlərindən və s. tarixi məxəzlərdən yararlanmışdır[65]. Həsən bəy Rumlu farsdilli qaynaqlarla yanaşı, Osmanlı türkcəsində yazılmış tarix kitablarına da müraciət etmişdir[66]. Eyni zamanda, əsərdə bir çox tarixi sənədlərin mətni əksini tapmışdır[67]. Müəllifin öz qeydlərinə görə, o, son cildi yazarkən bir sıra hallarda hadisə şahidlərinin şərhlərinə yer vermiş, I Şah Təhmasibin və II Şah İsmayılın dövründə, Məhəmməd Xudabəndənin hakimiyyətə yüksəlişi vaxtında baş vermiş proseslərin təsviri zamanı isə xeyli dərəcədə öz şəxsi müşahidələrinə əsaslanmışdır[68]. Ş.Fərzəliyevin fikrincə, "Həsən bəy Rumlu özündən əvvəlki dövr hadisələrini əks etdirən tarixi əsərlərdən kor-koranə istifadə etməmiş, yeri gəldikcə, onların bəzisinə düzəliş vermiş, hadisələrin yazılışı zamanı dəqiqliyə riayət olunmasını arzulamışdır"[69].

"Əhsənüt-təvarix" özündən sonra yazılan bir sıra tarixi əsərlər üçün mühüm mənbə rolunu oynamışdır. Görkəmli Azərbaycan tarixçisi İsgəndər bəy Münşinin "Tarixi-aləmarayi-Abbasi", Qazı Əhməd Quminin "Xülasətüt-təvarix", naməlum müəllifin "Tarixi-aləmarayi-Şah İsmayıl", Şeyx Məhəmməd Bəqa Səxanpurinin "Miratül-aləm", Mirzə bəy Cünabədinin "Rövzətüs-Səfəviyyə" kimi əsərlərində "Əhsənüt-təvarix"in təsiri duyulmaqdadır[70].

Həsən bəy Rumlunun öz qeydlərindən məlum olur ki, o, əsərinin dövrümüzə çatmış variantının böyük bir qismini h. 980 / m. 1572-73-cü ildə yazmış[71], lakin daha sonra hadisələrin təsvirini h. 985 / m. 1578-ci ilə kimi davam etdirmişdir[72]. Dövrümüzə gəlib çatan cildlərdən biri h. 807-899 / m. 1404-1494-cü illərin[73], digəri isə h. 900-985 / m. 1494-1578-ci illərin hadisələrini əhatə edir[74]. Bizim tərcüməmizdə bu cildlər müvafiq surətdə şərti olaraq birinci və ikinci cildlər adlandırılmışdır.

**Əsərin əlyazma nüsxələri.** "Əhsənüt-təvarix" Səfəvi dövrünün ən məşhur salnamələrindən biridir. Müxtəlif dövlət kitabxanalarında və şəxsi kolleksiyalarda əsərin çoxsaylı nüsxələri mühafizə edilməkdədir. Bunlara nümunə olaraq, mənbənin AMEA M.Füzuli adına Əlyazmalar İnstitutunda, Tehrandakı İslami Şura Məclisi Kitabxanasında, Tehran Universitetinin Mərkəzi Kitabxanasında, Tehran Universitetinin Ədəbiyyat Fakültəsinin kitabxanasında, Tehrandakı Gülüstan Kitabxanasında, Məlik Milli Kitabxanasında, Məşhəddəki Fərrux kitabxanasında, Tacikistan Elmlər Akademiyasında, Sankt-Peterburqdakı Saltıkov-Şedrin adına kitab-

---

[63] Bax: *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, II c., s.770-771.*

[64] Bu müəllifin adının Bicən olduğu ehtimal edilir (bax: *O.Ə.Əfəndiyev. Salnaməçi Bicən Şah İsmayıl Xətai haqqında // Şah İsmayıl Xətai (məqalələr toplusu). Bakı, 1988, s.17-28*).

[65] *Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.26-35.* Son araşdırmalar Həsən bəy Rumlunun XVI əsr Azərbaycan tarixçisi Həyati Təbrizinin 914 / 1508-ci ilə qədərki Səfəvi tarixindən bəhs edən xronikasından da istifadə etdiyini göstərir. Bax: *K.Ghereghlou. Ḥayâti Tabrizi (Qâsem Beg) // Encyclopædia Iranica, online edition, 2016, available at http://www.iranicaonline.org/articles/hayati-tabrizi (accessed on 28 June 2016)*

[66] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, s.187,496,773.*

[67] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, II c., s.1043-1045,1186-1195 və s.*

[68] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, III c., s.907,1103,1301,1336-1337,1550; Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.16.*

[69] *Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.15.*

[70] Bax: *Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.37-40.*

[71] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, I c., s.498,589; II c., s.807; III c., s.1280,1348,1450.*

[72] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, III c. s.1535-1556.*

[73] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, s.103-898.*

[74] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, s.899-1556.*

xanada (indiki Rusiya Milli Kitabxanası), İstanbuldakı Nuruosmaniyyə, Bayəzid və Əsəd Əfəndi kolleksiyalarında, İngiltərədəki Bodleian kitabxanasında, Britaniya Muzeyində, Paris Milli Kitabxanasında, Ellis kolleksiyasında və s. saxlanan əlyazma nüsxələrini misal göstərmək olar[75].

Bakıda, AMEA M.Füzuli adına Əlyazmalar İnstututunda əsərin son cildinin B-1696 və S-435 şifrəli iki əlyazma nüsxəsi mühafizə olunur.

B-1696 şifrəli nüsxə şikəstə elemetlərinə malik kalliqrafik nəstəliq xətti ilə köçürülmüşdür. Kağızları incə, sarımtıl və pardaxlıdır. Mətn qızılı haşiyələrlə çərçivələnmişdir. Vərəqlər sadə karandaşla, müasir rəqəmlərlə nömrələnmişdir. Əlyazmanın 1 və 2-ci səhifələri zərli ornamentlərlə bəzədilmişdir. Mətni qara, başlıqları isə qırmızı mürəkkəblə yazılmışdır. Paleoqrafik xüsusiyyətlərinə görə XVII əsrin birinci yarısına aid edilir. Ölçüsü 24x14,5 sm, həcmi 265 vərəqdir[76]. Əlyazma kitabı üzərində bərpa işlərinin aparıldığı və göy rəngli karton cildə salındığı müşahidə edilməkdədir.

Başlanğıcı:

حمد و سپاس و شکر بیحد و قیاس سلطانی را سزاست که سرادقات عز و جلالش از سمت حدوس و امکان مبراست...

Sonu:

...ساطان عثمان اول دولتش در ششصد و هشتاد و نه فوتش در هفصد و بیست و هفت ایام سلطنتش...

Nüsxə üzərində apardığımız araşdırmalar nəticəsində onun əskik və üstün cəhətlərini müəyyənləşdirməyə çalışdıq. İlk növbədə nüsxədə bəzi boşluqların və sistemsizliklərin olduğu nəzərə çarpır:

Nüsxənin 7-ci və 8-ci vərəqləri arasında mətnin ardıcıllığının pozulduğunu müəyyənləşdirdik. Belə ki, 7b vərəqinin sonunda h. 900-cü ilin hadisələri şərh edilərkən Şah İsmayılın bibisi Şah Paşa xatunun öz əri Məhəmməd bəylə birlikdə Lahicandan gələn hədiyyələri qarşılamaq üçün Ərdəbilin Kurim kəndinə getmələri təsvir olunur, 8a vərəqi isə h. 905-ci il hadisələri çərçivəsində Şah İsmayıla Ərcüvanda sui-qəsd təşkil etmək cəhdinin üstünün açılması ilə başlanır. Əlyazmadakı bu boşluq Tehran çapının (1389 h. ş.) 911-936-cı səhifələrini əhatə etməkdədir.

Əlyazma kitabının 13b vərəqi h. 905-ci ildə Xorasan vilayətində baş vermiş hadisələrin (Bədiüzzaman mirzənin Herata yürüşü) təsviri ilə bitir (mətnin bu yeri Tehran çapının 946-cı səhifəsinə müvafiqdir). Lakin 14a vərəqi h. 901-ci il hadisələrinin "Müxtəlif əhvalatlar" bölümü ilə başlayır. Bu isə Tehran nəşrinin 915-ci səhifəsinə uyğundur. Daha sonra hadisələrin ardıcıllığı davam edir və 21b vərəqi h. 905-ci ilin hadisələri daxilində İsmayılın Lahicandan çıxmasının təsviri ilə qurtarır. Mətnin bu parçası Tehran çapının 934-cü səhifəsinə müvafiqdir. Göründüyü kimi, kitab cildlənərkən yanlışlığa yol verilmiş, 8a-13b vərəqləri 21b vərəqindən sonra yer almalı olduğu halda, daha əvvələ keçirilmişdir.

Mətnin 21 və 22-ci vərəqləri arasında bir boş vərəq var. 22a vərəqi 906-cı ilin hadisələrinin təsviri ilə (Ərzincandakı hərbi müşavirə ilə) başlayır. Bu isə Tehran çapının 954-cü səhifəsinə uyğun gəlir.

Nüsxənin 50-51-ci vərəqləri arasında bir vərəqin düşdüyünü təxmin edirik. Çünki 50b vərəqi h. 911-ci ildə Teymuri hökmdarı Sultan Hüseyn Bayqaranın ölümündən sonra onun oğullarının (Bədiüzzaman mirzə ilə Müzəffər Hüseyn mirzənin) şərikli hökmdar elan olunması ilə qurtarır (mətnin bu yeri Tehran nəşrinin 1012-ci səhifəsində dərc edilmişdir). Lakin 51a vərəqi h. 912-ci ildə Şeybani xanın elçisinin Herat sarayındakı çıxışı ilə başlayır (bu isə Tehran çapının 1015-ci səhifəsinə uyğundur).

Beləliklə, bütün bu müqayisələr onu göstərdi ki, Tehran nəşrinin 911-915, 934-936, 946-954 və 1012-1015-ci səhifələri arasındakı mətnlər hal-hazırda əlyazma nüsxəsində əksini tapmamışdır. Bunlardan əlavə, 144-145-ci, 258-259-ci (h. 977-ci ilin hadisələrinin təsviri) və 263-264-cü vərəqlər (Təbriz üsyanının şərhi) arasından ən azı bir vərəqin düşdüyünü təsbit etdik.

Həsən bəy Rumlu "Əhsənüt-təvarix"i h. 985-ci ilin hadisələrinə kimi davam etdirsə də, bəhs etdiyimiz Bakı nüsxəsində hadisələrin təsviri h. 982-ci ilin əhvalatları daxilində yer alan "Ölümlər" bölümündə, II Sultan Səlimin vəfatı ilə əlaqədar olan açıqlamalarda yarımçıq qalmışdır. Mətnin bu qismi Tehran çapının

[75] Bax: *Ч.А.Стори. Персидская литература, ч. II, с.860-861;* http://www.aghabozorg.ir/search.aspx

[76] Bu nüsxənin paleoqrafik xüsusiyyətləri haqqında məlumat aşağıdakı əlyazma kataloqlarından alınmışdır: *M.Sultanov. Əlyazmaları kataloqu (Azərbaycan SSR EA Respublika Əlyazmaları Fondu). I cild (tarix, coğrafiya, ədəbiyyat nəzəriyyəsi, təzkirələr, bədii ədəbiyyat və münşəat). Bakı, 1963, s.26-27; Г.Наджафов. Каталог персидских рукописей (сочинения по истории и географии). Баку, 2013, с.34-35.*

1490-cı səhifəsinə uyğun gəlir və həmin nəşrdə əksini tapmış mətnin son səhifəsi olan 1556-cı səhifəyə qədər məlumatlar sözügedən Bakı nüsxəsində yer almamışdır.

Vərəqlərin düşməsi və ya cildləmə zamanı yerlərinin dəyişik salınması nəticəsində meydana gəlmiş bu kimi boşluqlarla yanaşı, əlyazma nüsxəsinin bəzi digər yerlərində də çatışmazlıqlar hiss edilir. Məsələn, burada h. 916-cı il hadisələrinin təsviri zamanı Şeybani xanın Şah İsmayıla göndərdiyi məktubun mətninə (bax: Tehran çapı, səh. 1043-1045) yer verilməmişdir. Halbuki mətnin həmin yerində (63b vərəqində) hansı-sa bir vərəqin düşməsindən söhbət gedə bilməz.

Tehran çapında (səh. 1202-1203) h. 937-ci il hadisələri daxilində yer almış "Rumda baş vermiş hadisələr haqqında söhbət" adlı bölümə də bu nüsxə daxilində rast gəlmirik. Sözügedən Bakı nüsxəsinin 97-ci vərəqində h. 924-cü ilin hadisələri yanlışlıqla h. 923-cü ilin hadisələri daxilində verilmişdir. Əlyazmanın 233-cü vərəqində h. 964-cü il hadisələrindən yalnız "Ölümlər" bölümü əksini tapmış, lakin bu bölüm də səhvən h. 963-cü ilin hadisələrinə ayrılmış fəslin ardı kimi təqdim olunmuşdur. Eyni zamanda, 99b-100b vərəqlərində h. 927-ci ilin hadisələri daxilində təsvir edilmiş "Rumda baş vermiş hadisələr" və "Müxtəlif əhvalatlar" bölümlərinin yeri dəyişik düşmüşdür.

Bütün bu nöqsanlarına baxmayaraq, Bakı nüsxəsinin bir sıra üstün özəllikləri də vardır. Bu özəlliklərin ən birincisi, heç şübhəsiz ki, Şah Təhmasibin özbək hökmdarı Übeyd xana göndərdiyi cavab məktubunun mətnidir[77]. Qeyd edək ki, h. 936-cı ildə yazılmış bu məktubun mətni nə Ç.N.Seddonun 1931-ci ildə, nə də Ə.Nəvainin 2010-cu ildə nəşr etdirdikləri elmi-tənqidi mətnlərə daxil edilməmişdir. Buna görə də biz həmin məktubun mətnini məhz Bakı nüsxəsindən tərcümə etmişik. Bundan başqa, sözügedən Bakı nüsxəsinin köməyi ilə bir sıra şəxslərə və hadisələrə dair yeni məlumatlar əldə edilmiş və tərcümə olunmuşdur. Məsələn, I Şah İsmayılın sərkərdələrindən olan "Tozqoparan" ləqəbli Qara Piri bəy Qacarın Ziyadoğlular nəslinə aid olduğunu biz sadəcə Bakı nüsxəsindən öyrənirik[78].

"Əhsənüt-təvarix" əsərinin digər bir əlyazma nüsxəsi M.Füzuli adına Əlyazmalar İnstitutunda S-435 şifrəsi ilə mühafizə edilməkdədir. Bu nüsxə nəstəliq xətti ilə sarımtıl dəftərxana kağızlarının tək üzünə köçürülmüş, açıq yaşıl rəngli karton cildə salınmışdır. Mətn qara mürəkkəblə, başlıqlar isə bəzən qara, bəzən qırmızı mürəkkəblə yazılmışdır. Səhifələr ərəb rəqəmləri ilə nömrələnmişdir. Paleoqrafik xüsusiyyətlərinə görə XX əsrin ortalarına aid edilə bilər. Ölçüsü: 30,3 x 18,5 sm., həcmi 235 vərəqdir.

Əvvəli:

حمد و سپاس و شکر بیحد و قیاس سلطانی را سزاست که سرادقات عز و جلالش از سمت حدوس و امکان مبراست...

Sonu:

...مرد صفت ترس برون کن ز سر؛ همچو زنان عذر میاور دگر؛ یک دو قدم پیش نه از بهر جنگ؛ کز تو کسی...

Müqayisələr nəticəsində bu nüsxənin Əlyazmalar İnstitutundakı B-1696 şifrəli digər nüsxədən köçürüldüyünü müəyyənləşdirdik. Belə ki, ilk nüsxədə olan boşluqlar, xronoloji ardıcıllığın pozulması kimi hallar, adların və istilahların yazılması zamanı yol verilmiş xətalar eyniylə bu nüsxədə də təkrar edilmişdir. Bəzi yerlərdə isə katib yazı xətalarını təshih etməyə çalışmış, ilk nüsxədə yazılmış yanlış variantı olduğu kimi köçürsə də, mötərizədə həmin sözün təshih olunmuş formasını yazmışdır. Məsələn, I nüsxənin 14a vərəqində səhvən "pesər-e məzar-e Şeyx Sədi" yazılmışdır. II nüsxənin katibi öz əlyazmasının 21-ci vərəqində bu ifadəni mötərizə daxilində təshih etmişdir: "pesər-e (be sər-e) məzar-e Şeyx Sədi". Katib bəzən mətndəki boşluqları və hadisələrin ardıcıllığının pozulduğunu fərq etmiş və həmin yerlərdə ulduz işarəsi qoymuşdur[79]. Lakin haqqında bəhs etdiyimiz bu nüsxə ilk nüsxənin tam köçürülmüş variantı deyil. Çünki burada hadisələrin təsviri h. 936-cı ilin hadisələrində, Şah Təhmasibin Übeyd xana yazdığı məktubun mətnində yarımçıq qalır.

**Əsərin nəşrləri və başqa dillərə tərcümələri.** Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsərinin farsca mətnindən parçalar ilk dəfə Sankt-Peterburqda saxlanan bir əlyazma nüsxəsi əsasında 1858-ci ildə akad. B.Dorn tərəfindən "Xəzəryanı ölkələrin cənub sahillərinin tarixinə dair müsəlman mənbələri" adlı ki-

[77] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix. AMEA M.Füzuli adına Əlyazmalar İnstitutu, B-1696, v.134b-140b.*
[78] *Həmin əlyazma, v.65a.*
[79] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix. AMEA M.Füzuli adına Əlyazmalar İnstitutu, S-435, v.11,33.*

tabda nəşr edilmişdir[80]. Daha sonra Ç.N.Seddon ilk dəfə olaraq "Əhsənüt-təvarix"in son cildinin elmi-tənqidi mətnini hazırlamışdır. O, bu mətni hazırlayarkən əsərin Bodleian kitabxanasında, A.G.Ellisin şəxsi kolleksiyasında və Britaniya Muzeyində mühafizə edilən əlyazma nüsxələrindən istifadə etmişdir[81]. Ç.N.Seddonun hazırladığı bu mətn və onun ingiliscə müxtəsər tərcüməsi 1930-cu illərdə Hindistanda Baroda Şərqşünaslıq İnstitutu tərəfindən iki cilddə işıq üzü görmüşdür. İlk cild əsərin farsca mətnini[82], ikinci cild isə ingiliscə qısa tərcüməsini əhatə edir[83]. Əsərin bu nəşrinin farsca mətni əhatə edən ilk cildi 1968-ci ildə Tehranda yenidən çap olunmuşdur[84].

Lakin əsərin dövrümüzə gəlib çatmış hər iki cildinin daha dolğun elmi-tənqidi mətni İran alimi Əbdülhüseyn Nəvai tərəfindən tərtib edilmişdir. Ə.Nəvai əsərin h. 807-899-cu illərdən bəhs edən cildinin mətnini hazırlayarkən İstanbuldakı Nuruosmaniyyə kitabxanasında və Paris Milli Kitabxanasında saxlanan əlyazma nüsxələrindən faydalanmış, h. 900-985-ci illərin hadisələrini əhatə edən son cildin elmi-tənqidi mətnini tərtib etmək üçün Ç.N.Seddonun nəşrindən, İstanbuldakı Nuruosmaniyyə və Tehrandakı Məclis kitabxanalarının nüsxələrindən yararlanmışdır. Ə.Nəvainin hazırladığı bu kitab ilk dəfə iki cilddə (1349 / 1970-ci ildə ilk cildi və 1357 / 1978-ci ildə ikinci cildi) nəşr edilmişdir. 1384 / 2005-ci ildə həmin nəşr üç cild halında təkrar yayınlanmışdır. 1389 / 2010-cu ildə isə bu üç cildlik nəşr yenidən işıq üzü görmüşdür[85].

İndiyə kimi "Əhsənüt-təvarix" natamam formada bəzi dillərə tərcümə edilmişdir. Əsərin son cildinin Ç.N.Seddon tərəfindən həyata keçirilmiş ingiliscə müxtəsər tərcüməsi haqqında yuxarıda məlumat verdik. Həmin tərcümədən sonra A.K.Arends mənbənin son cildinin Türkmənistan tarixi ilə bağlı hissələrini Sankt-Peterburqdakı keçmiş İmperator Kitabxanasında (indiki Rusiya Mlli Kitabxanasında) saxlanılan və B.Dornun kataloqunda təsvir edilən 287 saylı əlyazma nüsxəsi əsasında ixtisarla rus dilinə tərcümə etdi. Bu tərcümə "Türkmənlərin və Türkmənistanın tarixinə dair materiallar" adlı toplunun II cildində işıq üzü görmüşdür[86].

Bundan əlavə, gürcü alimi V.S.Puturidze "Həsən Rumlunun Gürcüstan haqqında məlumatları" adlı kitabda "Əhsənüt-təvarix"in yuxarıda xatırlatdığımız B.Dorn nüsxəsi əsasında mənbənin Gürcüstan tarixi ilə əlaqədar hissələrinin farsca mətni ilə yanaşı, onların gürcücə tərcüməsini də 1966-cı ildə Tiflisdə nəşr etdirmişdir. Mütərcim V.S.Puturidzenin ön sözü ilə çap edilən kitaba R.K.Kiknadze şərhlər yazmışdır[87].

"Əhsənüt-təvarix"in h. 807-899-cu illəri əhatə edən cildi Ə.Nəvainin nəşri əsasında M.Öztürk tərəfindən türk dilinə tərcümə edilmiş və Türk Tarix Qurumu tərəfindən yayınlanmışdır[88]. C.Cevan isə yenə də Ə.Nəvainin nəşrindən istifadə edərək "Əhsənüt-təvarix"in I Şah İsmayıl dövrünə aid hissəsini türkcəyə çevirmişdir[89]. Ş.Fərzəliyev özünün monoqrafiya və məqalələrində "Əhsənüt-təvarix"in bəzi parçalarından etdiyi tərcümələrə yer vermişdir.

Göründüyü kimi, Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsərinin elmi-tənqidi mətnləri hazırlansa da, mənbə hələ heç bir dilə tam tərcümə edilməmişdir. Əsərin ingiliscə tərcüməsi müxtəsər olub, yalnız son cildi əhatə etməkdədir. Rusca müxtəsər tərcümə yalnız Türkmənistanın, gürcücə tərcümə isə yalnız Gürcüstanın tarixinə dair məlumatların tərcüməsindən ibarətdir. Əsərin türkcə tərcümələri dövrümüzə çatmış iki cilddən birincisinin tamamını əhatə etsə də, son cildin yalnız I Şah İsmayıl dövrünü əhatə etmişdir. Beləliklə, bizim tərcüməmiz "Əhsənüt-təvarix"in farscadan başqa bir dilə ilk tam tərcüməsi hesab edilə bilər.

**Hazırkı tərcümənin xüsusiyyətləri.** 2009-cu ildə O.Əfəndiyevlə birlikdə İsgəndər bəy Münşinin "Tarixi-aləmarayi-Abbasi" əsərini nəşr etdirdikdən sonra mərhum ustadım mənə Həsən bəy Rumlunun

---

[80] *B.Dorn. Muhammedanische Quellen zur Geschichte der südlichen Küstenländer des Kaspischen Meeres. Theil IV. St. Petersburg, 1858, s.375-431.*

[81] *C.N.Seddon. Hasan-i Rumlu's Ahsanu't-tawárikh, p.307-308.*

[82] *A Chronilcle of the Early Safawis Being the Ahsanu't-Tawarikh of Hasan-i Rumlu. Vol. I (Persian text). Edited by C.N.Seddon. Baroda: Oriental Institute, 1931.*

[83] *A Chronilcle of the Early Safawis Being the Ahsanu't-Tawarikh of Hasan-i Rumlu. Vol. 2 (English Translation). Translated by C.N.Seddon. Baroda: Oriental Institute, 1934.*

[84] *Həsən-i Rumlu. Əhsənüt-təvarix (təshih: Ç.N.Seddon). Tehran: əş-Şəms, 1347.*

[85] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix (Təshih və təhşiyə: Ə.Nəvai). Tehran: Əsatir, 1389.*

[86] *Хасан-бек Румлю. Ахсан-ут-таварих / Наилучшая из историй (пер. А.К.Арендса) // Материалы по истории туркмен и Туркмении, Том II. XVI-XIX вв. Иранские, бухарские и хивинские источники. Москва – Ленинград, 1938, с.52-64.*

[87] Bax: *Ч.А.Стори. Персидская литература, ч. II, с.861.*

[88] *Hasan-ı Rumlu. Ahsenü't-Tevârîh (çeviren: M.Öztürk). Ankara, 2006.*

[89] *Rumlu Hasan. Şah İsmail Tarihi (Ahsenü't-Tevârîh). Ankara, 2004.* Bu kitaba Ş.Keçeli və Z.Vəliyeva şərhlər yazmışlar.

“Əhsənüt-təvarix” əsərini də müştərək surətdə tərcümə etməyi təklif etdi. Böyük alimin bu təklifini müsbət dəyərləndirərək onunla daha bir ortaq elmi layihədə iştirak etmək şərəfinə nail oldum. Təəssüf ki, üzərində xeyli zəhmət çəkdiyi bu əsərin nəşrini görmək O.Əfəndiyevə nəsib olmadı. Ustadımız 2013-cü ilin fevralında, 87 yaşının tamam olmasına bir ay qalmış Haqqın rəhmətinə qovuşdu. Vəfat etdiyi zaman tərcümə ilə bağlı öhdəsinə götürdüyü işi yekunlaşdıraraq əlyazmalarını kompüterdə yığılmaq üçün mənə təhvil vermişdi və tərcüməyə dair şərhlərin yazılması ilə məşğul idi. Vəfatı ərəfəsində ağır ürək əməliyyatı keçirmiş görkəmli tarixçimizin mənə son vəsiyyətlərindən biri də “Əhsənüt-təvarix” üzərində işi tamamlamaqdan və nəşr etdirməkdən ibarət olmuşdur[90].

2011-ci ildə o zamanlar Tehran Universitetinin doktorantı olan Esra Doğan bir elmi konfransda iştirak etmək üçün Bakıya gəldiyi zaman böyük bir lütfkarlıq göstərərək, “Əhsənüt-təvarix”in İranda yenicə çapdan çıxmış üç cildlik mətnini bizə təqdim etdi. Hal-hazırda tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsi alaraq Türkiyənin Artuklu Universitetində fəaliyyətini davam etdirən Esra xanıma bu lütfkarlığından ötrü dərin təşəkkürümü bildirirəm.

Tərcümə zamanı “Əhsənüt-təvarix”in Ə.Nəvai tərəfindən 2010-cu ildə həyata keçirilmiş son nəşri əsas alınmışdır. Bundan əlavə, mənbənin 1931-ci ildə işıq üzü görmüş Baroda nəşrindən və Bakıda saxlanan əlyazmalarından da istifadə edilmişdir. Bir sıra dəqiqləşdirmələr və müqayisələr aparmaq üçün əsərin ingiliscə və türkcə tərcümələrinə nəzər salınmışdır. Şərhlərin yazılması zamanı Ə.Nəvainin, Ç.N.Seddonun və M.Öztürkün “Əhsənüt-təvarix”ə yazdıqları qeyd və izahatlardan, həmçinin bir sıra digər mənbə və ədəbiyyatlardan istifadə olunmuşdur. Əsərin Baroda və Tehran nəşrlərində əksini tapan və məzmuna təsir göstərən ən mühüm nüsxə fərqləri səhifə altındakı qeydlərdə göstərilmişdir[91]. Bunlara əlavə olaraq, B-1696 şifrəli Bakı nüsxəsindəki önəmli ayrıntılara da qeydlərdə yer verilmişdir. Bakı nüsxələri əsasında mətnə əlavə edilən parçalar kursiv şəklində verilmiş və səhifə altında bu parçaların hansı əlyazma vərəqlərini əhatə etdiyi bildirilmişdir.

Mənbə üzərində apardığımız iş prosesində, bir tərəfdən əsərin tərcüməsinin müasir oxucu üçün doğma və anlaşılan tərzdə olmasına cəhd göstərilmiş, digər tərəfdən də tərcümə zamanı mənbənin özünəməxsus xüsusiyyətlərini və dəbdəbəli üslubunu qoruyub saxlamağa diqqət yetirilmişdir. Dövrün terminologiyasını dəqiq ifadə etmək üçün dövlət quruluşu ilə bağlı istilahlar (vəzifə adları, hərbi terminlər, vergi növləri və s.) orijinalda olduğu kimi verilmiş, səhifə altında onlara dair şərhlər və izahlar təqdim olunmuşdur. Mənbənin mətnində olmayan, lakin cümlənin mənasının anlaşılması üçün gərəkli olan sözlər düzbucaqlı mötərizə [...] daxilində qeyd olunmuşdur. Mənbədə əksini tapmış, lakin tərcümə zamanı əlavə izahata ehtiyacı olan fikir və ibarələrdən sonra adi mətərizə (...) içində aydınlaşdırıcı ifadələrə yer verilmişdir. Hicri tarixlərin miladi təqvimlə qarşılığı və tərcümə olunmuş bəzi özünəməxsus ifadələrin orijinal mətndəki yazılışının transfonelitərasiyası da adi mötərizə daxilində əks olunmuşdur.

Hicri təqvimlərin miladi təqvimə çevrilməsi zamanı Türk Tarix Qurumunun internetdə yerləşdirilmiş onlayn tarix çevirmə qılavuzundan[92], F.R.Unatın[93] və V.V.Çıbulskinin[94] cədvəllərindən yararlanmışıq. Mənbədə tarixlər göstərilərkən bəzi yerlərdə ayın tarixləri ilə yanaşı həftənin günləri də qeyd edilmiş, bir sıra hallarda isə həftənin günləri əksini tapmamışdır. Bəzən klasik mənbələrdə tarixlər hicri təqvimdən miladi təqvimə çevrilərkən həftənin günləri ilə bağlı uyğunsuzluqlar ortaya çıxır. “Əhsənüt-təvarix”in də bəzi yerlərində bu nüansla qarşılaşırıq. Belə olan təqdirdə, yuxarıda göstərdiyimiz təqvim çevirmə cədvəlləri əsas götürülərək ayın günləri hicridən miladiyə çevrilmiş, həftənin günləri ilə bağlı uyğunsuzluq isə səhifə altındakı qeydlərdə göstərilmişdir. “Quran” ayələrinin dilimizdə ifadə edilməsi zamanı Z.Bünyadovun və V.Məmmədəliyevin tərcüməsi əsas alınmışdır.

---

[90] Bir müddət əvvəl, dünya üzrə milyonlarla tədqiqatçını birləşdirən internet resurslarından biri olan academia.edu saytında O.Əfəndiyevin əsərlərinin yerləşdirilməsinə başlamışıq. Hazırda mərhum tarixçimizin 9 kitabı və 21 məqaləsi ilə adı çəkilən saytda tanış olmaq mümkündür: https://science.academia.edu/OktayEfendiyev

[91] Bodleian, Ellis və London (Britaniya Muzeyi) nüsxələrindəki fərqlər Ç.N.Seddonun, Nuruosmaniyyə, Paris və Məclis nüsxələrindəki fərqli cəhətlər isə Ə.Nəvainin nəşrindən iqtibas edilmişdir.

[92] *http://www.ttk.gov.tr/index.php?Page=Sayfa&No=385*

[93] *F.R.Unat. Hicri tarihleri Miladi tarihe çevirme kılavuzu. Ankara, 1988.*

[94] *В.В.Цыбульский. Современные календари стран Ближнего и Среднего Востока. Москва, 1964.*

Tərcümə edilmiş mənbənin iri həcmini və klassik Şərq tarixçiliyinə xas olan təmtəraqlı ibarələrlə zəngin olmasını nəzərə alsaq, burada müəyyən qəliz cümlələrin və ifadələrin, həmçinin redaktə və korrektura baxımdan bəzi xətaların olması mümkündür. Hörmətli oxuculardan bu cəhəti nəzərə almalarını xahiş edirəm və söyləyəcəkləri irad və təkliflərə görə onlara əvvəlcədən öz təşəkkürlərimi bildirirəm[95].

**Mənbənin öyrənilməsi və dəyərləndirilməsi.** Azərbaycan tarixşünaslığında Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri O.Əfəndiyevin ilk aspirantı olmuş Ş.Fərzəliyev tərəfindən namizədlik dissertasiyası çərçivəsində kompleks şəkildə tədqiqata cəlb edilmiş və bu əsərin Azərbaycanın XV-XVI əsrlər tarixin mənbəyi kimi əhəmiyyəti üzə çıxarılmışdır[96]. Alimin bu barədə monoqrafiyası və çoxsaylı məqalələri nəşr edilmişdir.

Ş.Fərzəliyevdən başqa, vətən tarixşünaslığında O.Əfəndiyev, M.Heydərov, Ə.Rəhmani, S.Aşurbəyli, S.Onullahi, T.Musəvi, Ə.Rəcəbli, Y.Mahmudov, Ş.Mustafayev, Ş.Məmmədova, Z.Bayramlı, T.Nəcəfli, X.Qasımov, R.Ağayev, R.Məmmədova, Q.Şükürov və digərləri öz tədqiqatları zamanı "Əhsənüt-təvarix"dən yararlanmışlar. Əcnəbi tədqiqatçılardan E.G.Broun, V.Hinz, Q.Sərvər, V.F.Minorski, Ç.A.Stori, İ.P.Petruşevski, P.İ.Petrov, N.Fəlsəfi, M.N.Şeybani, R.Seyvori, H.R.Roemer, K.M.Rohrborn, E.Glassen, F.Sümer, F.Kırzıoğlu, A.Allouç, C.C.Reid, M.Haneda, Ş.A.Quinn, T.Gündüz, K.Kutsiya, N.Gelaşvili, O.Ekayev, H.Mircəfəri, Ə.G.Məani, M.K.Yusif-Camali, R.Cəfərian və başqaları "Əhsənüt-təvarix"dən istifadə etmişlər. Ümumiyyətlə, "Əhsənüt-təvarix" ən çox istinad edilən Səfəvi mənbələrindən biridir.

Həsən bəy Rumlunun əsərini dövrün digər mənbələri ilə müqayisə edən O.Əfəndiyev aşağıdakı nəticələrə gəlir: "Həsən Rumlunun dili çətin olmayıb, yığcamlığı və səlisliyi ilə seçilir. O, yalnız döyüşlərin təsviri zamanı, nəzərdən keçirilən dövrün farsdilli tarixşünaslığı üçün səciyyəvi olan obrazlı və təmtəraqlı ifadə üsuluna meyil edir… Qızılbaş hərbi-feodal aristokratiyasının nümayəndəsi və şahın məmurlarından olan Həsən Rumlu, təbii ki, Səfəvilərin və şiəliyin sadiq tərəfdarı kimi çıxış edir. Eyni zamanda, Həsən Rumlunun yanaşması obyektivlik baxımından Xandəmirin yanaşmasından müsbət mənada fərqlənir"[97].

O.Əfəndiyev "Əhsənüt-təvarix"i dəyərləndirərkən bu əsərin daha çox I Şah Təhmasibin hakimiyyəti dövrünün ən mühüm mənbəyi kimi diqqət çəkdiyini bildirir: "I Təhmasibin yarım əsrlik hakimiyyəti dövründə baş vermiş hadisələr başqa heç bir mənbədə Həsən bəy Rumlunun əsərində olduğu qədər ətraflı bir şəkildə şərh edilmir. Əgər anonim müəllifin əsəri I Şah İsmayılın tarixinə dair ən dolğun mənbədirsə, "Əhsənüt-təvarix" də I Şah Təhmasibin dövrünə dair belə bir əzəvedilməz mənbə olaraq qalır"[98].

"Əhsənüt-təvarix"i xüsusi şəkildə tədqiq etmiş Ş.Fərzəliyevin bu mənbə haqqında fikirləri maraq doğurur: "Orta əsr tarixi mənbələri arasında azərbaycanlı tarixçi Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri xüsusi yer tutur… Həsən bəy Rumlu dövlət quruluşu, iqtisadi vəziyyət, feodal münasibətləri, ordu və siyasi tarix haqqında qiymətli məlumatlar verən müəllifdir. Onun qələmə aldığı bir sıra məsələlər dövrün başqa tarixçilərinin kitablarında ya tamamilə öz əksini tapmamış, ya da çox ötəri qeyd edilmişdir"[99]. Ş.Fərzəliyev də "Əhsənüt-təvarix"in dövrün bir sıra salnamələri ilə müqayisədə daha üstün cəhətlərə malik olduğunu bildirir: "Həsən bəy Rumlu da başqa salnaməçilərin yazı ənənəsinə uyğun olaraq öz əsərini təsviri səpkidə qələmə almışdır. Lakin onu başqa müəlliflərdən fərqləndirən başlıca cəhət, yeri gəldikcə, hadisələrə öz şəxsi, orijinal münasibətini bildirməsidir. Salnamənin IX cildinin kompilyativ xarakter daşımasına baxmayaraq, orada da müəllifin hadisələrə və onların iştirakçılarına münasibətini görmək olur. Ən əsası isə budur ki, "Əhsənüt-təvarix" əsərindəki hadisələr başqa farsdilli orta əsr məxəzlərinə nisbətən daha dolğun şəkildə əks etdirilmişdir"[100].

Qeyd edək ki, müəllif XV yüzilliyin hadisələrindən bəhs edərkən əsas etibarilə özündən əvvəlki tarixçilərin əsərlərindən bəhrələnsə də, həmin əsrin tarixi barəsində də bəzi hallarda orijinal məlumatlar vermə-

---

[95] Hazırladığımız bu əsər kitabxanalara verilmək məqsədi ilə məhdud sayda nəşr ediləcək, lakin eyni zamanda geniş oxucu kütləsinin istifadə edə bilməsi üçün elektron formada müxtəlif onlayn kitabxana saytlarında yerləşdiriləcəkdir. Elektron mətnlərdə axtarış imkanlarının geniş olduğu nəzərə alınaraq kitab üçün göstəricilər tərtib edilməmişdir.

[96] *Ш.Ф.Фарзалиев. Сочинение Хасан-бека Румлу «Ахсан ат-таварих» как источник по истории Азербайджана. Автореферат диссертации на соискание ученой степени кандидата исторических наук. Баку, 1974.*

[97] *О.А.Эфендиев. Образование азербайджанского государства Сефевидов, с.18.*

[98] *О.А.Эфендиев. Азербайджанское государство Сефевидов, с.21.*

[99] *Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.3.*

[100] *Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.41.*

yə nail olmuşdur. Məsələn, Həsən bəy Rumlunun Səfəvi şeyxlərindən Şeyx Cüneydin və Şeyx Heydərin fəaliyyətinə dair verdiyi bəzi təfərrüatları bir sıra digər mənbələrdən, o cümlədən XV əsr qaynaqlarından ala bilmirik. Şirvanda Şeyx Cüneydin ölümü ilə başa çatmış döyüşün dəqiq tarixinin "Əhsənüt-təvarix"də göstərilməsi buna bir örnəkdir[101].

"Əhsənüt-təvarix"də bəzi hadisələrə və şəxsiyyətlərə dair ziddiyyətli münasibətlərlə qarşılaşırıq. Bu, əsas etibarilə müəllifin yararlandığı mənbələrin müxtəlifliyindən və əsərin yazılması prosesində siyasi konyukturanın dəyişməsindən irəli gəlir. Həsən bəy Rumlunun XV əsr hadisələrini şərh edərkən bəzi hallarda istifadə etdiyi mənbələrin təsiri altına düşdüyü nəzərə çarpır. Belə ki, salnaməçi Osmanlı qaynaqlarından iqtibas etdiyi hissələrin təsiri ilə Ağqoyunlu Həsən padşaha və onun tərəfdarlarına dair tənqidi fikirlər səsləndirsə də, Ağqoyunlu saray tarixçisi Əbu-Bəkr Tehraninin "Kitabi-Diyarbəkriyyə" əsərindən götürdüyü parçaların təsiri altında Həsən padşahı və onun tərəfdarlarını öymüşdür. Müəllifin həmçinin Qaraqoyunlu Cahanşahla bağlı bu cür ziddiyyətli fikirlərinə rast gəlirik. O, bəzi yerlərdə Cahanşaha hörmətlə yanaşsa da, "Kitabi-Diyarbəkriyyə"dən əxz etdiyi parçalarda bu hökmdara qarşı mənfi fikirlər ifadə etmişdir[102]. Əsərin bir yerində Teymuri hökmdarı Şahruxun hakimiyyətinin əbədi olması üçün dua edilir[103]. Halbuki Şahrux "Əhsənüt-təvarix" yazıldığı tarixdən çox əvvəllər vəfat etmişdi. Belə görünür ki, müəllif bu parçanı Teymuri mənbələrindən eyniylə köçürmüşdür.

XVI əsr tarixindən, öz dövrünün hadisələrindən bəhs edərkən Həsən bəy Rumlu siyasi vəziyyətdən asılı olaraq mövqeyini yenidən nəzərdən keçirməli olur. Məsələn, əvvəllər öz həmtayfası Hüseynqulu Xüləfa Rumlu ilə dostluq edən Həsən bəy Rumlu h. 957 / m. 1550-ci ildə onun kürdlərə qarşı döyüşdə göstərdiyi cəsarətdən söz açdığı və onu yaxşı tərəfdən təqdim etdiyi halda[104], II Şah İsmayılın (1576-1577) hakimiyyəti dövründə Hüseynqulu Xüləfa, padşahın qəzəbinə düçar olub vəzifədən çıxarıldıqdan sonra müəllifin ona qarşı münasibəti dəyişir və o, keçmiş döyüş yoldaşını öz əsərində ağır sözlərlə təhqir edir[105].

I Şah Təhmasibin hakimiyyətinin son illərində gələcək hökmdarı müəyyənləşdirmək uğrunda şahzadələrin tərəfdarlarının rəqabəti zamanı İsmayıl mirzənin tərəfini saxlayan, hətta "Əhsənüt-təvarix"in son cildinin müqəddiməsində bu əsəri İsmayıl mirzəyə həsr etdiyini yazan Həsən bəy Rumlu, İsmayıl mirzə II Şah İsmayıl adı ilə hakimiyyətə gəldikdən sonra öz əsərində yeni padşahın tərifini göylərə ucaldır[106]. Lakin hökmranlığı qısa çəkən bu padşahın ölümündən sonra müəllifin ona münasibətdə mövqeyi dəyişir və o, II Şah İsmayılı məzəmmət edir[107]. Bütün bunlar, heç şübhəsiz ki, dövrün amansız gerçəkləri içində özünü qorumağa və mövqe əldə etməyə çalışan müəllifin siyasi manevr cəhdlərinin göstəricisidirlər. Lakin məsələyə fərqli prizmadan baxdıqda, salnaməçinin siyasi hadisələrin seyirçisi deyil, birbaşa iştirakçısı olması onun əsərinin dəyərini daha da artırır.

Bəllidir ki, tarixçilik nəzəriyyəsi ilə məşğul olan mütəxəssislər tarixi əsərləri yazılış tərzinə görə üç əsas qrupa ayırırlar: 1) hekayəçi (rəvayətçi) tarix; 2) öyrədici (praqmatik) tarix; 3) araşdırıcı tarix[108]. Təəssüf ki, respublikamızda klassik tarixçilik irsimizin elmi meyarlar əsasında nəzəri baxımdan təsnifatlandırılması və dəyərləndirilməsi istiqamətində yetərincə iş görüldüyünü iddia edə bilmərik. Azərbaycan tarixşünaslığında hekayəçi tarix üsulu Moisey Kalankatlının "Alban tarixi" əsəri ilə başlamışdır. Praqmatik tarixçiliyimizin ilk bariz nümunəsinin İsgəndər bəy Münşinin "Tarixi-aləmarayi-Abbasi" əsəri olduğu qənaətindəyik. Araşdırıcı tarixçiliyimizin əsasını isə A.Bakıxanov özünün "Gülüstani-İrəm" əsəri ilə qoymuşdur. Həsən bəy Rumlunun yaradıcılığında müqayisə, təhlil, nəticə çıxarma və ümumiləşdirmə kimi qabaqcıl tarixçiliyə xas olan bəzi müstəsna elementlər nəzərə çarpsa da, istər qarşıya qoyulan məqsəd və vəzifələr, istərsə hadisələrin və proseslərin şərhi və təsvirində izlənilən metodlar, istərsə də bütövlükdə tarix anlayışı baxımından "Əhsənüt-

[101] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix. Tehran, 1389, II c., s.601-604.*
[102] Bu cəhət Ə.Nəvainin də diqqətini cəlb etmişdir. Bax: *Həsən bəy Rumlu. Əhsənüt-təvarix. Tehran, 1389, III c., s.397 (səhifəaltı 2-ci qeyd).*
[103] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix. Tehran, 1389, I c., s.294.*
[104] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix. Tehran, 1389, III c., s.1336-1337.*
[105] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix. Tehran, 1389, III c., s.1521.*
[106] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix. Tehran, 1389, III c., s.1518 və s.*
[107] *Həsən bəy Rumlu. Əhsənüt-təvarix. Tehran, 1389, III c., s.1543-1544.*
[108] *M.Kütükoğlu. Tarih araştırmalarında usûl. İstanbul, 1991, s.5-9.*

təvarix" hekayəçi tarixçiliyin üst qatlarına yüksəlməyə nail olsa da, praqmatik tarixçilik səviyyəsinə çata bilmir. Lakin bu amil, əsərin tarixi mənbə kimi əhəmiyyətini bir o qədər də azaltmır.

Həsən bəy Rumlu öz əsərində Azərbaycan tarixinə xüsusi yer vermiş, bir çox hallarda Azərbaycanda baş vermiş hadisələri ayrıca bölümlər daxilində, daha geniş şəkildə təsvir etmişdir. Burada vətənimizin təkcə hərbi-siyasi tarixinə deyil, eyni zamanda idarəçilik sisteminə, ictimai-iqtisadi vəziyyətinə və mədəni həyatına dair zəngin məlumatlarla qarşılaşırıq. Bütövlükdə XV-XVI əsrlər tariximizi "Əhsənüt-təvarix" qədər dolğun və təfərrüatlı bir şəkildə əks etsdirən mənbə tapmaq çətindir. Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri Azərbaycanla yanaşı, bir sıra Şərq ölkələrinin – İranın, İraqın, Türkiyənin, Gürcüstanın, Əfqanıstanın, Hindistanın, Çinin, Monqolustanın, Orta Asiya, Şimali Qafqaz və ərəb ölkələrinin, hətta Balkan və Krım yarımadalarının və s. məmləkətlərin müvafiq dövr tarixinə dair informasiyalara malik olan önəmli qaynaqlardan biridir.

Namiq Seyfulla oğlu Musalı
tarix üzrə fəlsəfə doktoru, dosent,
Türkiyə Respublikası Kastamonu Universiteti
Fən-Ədəbiyyat Fakültəsi Tarix Bölümü

Sentyabr, 2016

**MÜQƏDDİMƏ**

Mərhəmətli və rəhmli Allahın adı ilə!

Sonsuz həmd və şükür olsun o hakimə ki, məlaikələr (mələkut) aləminin sahəsi Onun izzət və şövkətinin xəlvət sarayıdır və qüdrət (cəbərrut) meydanının bargahı[109] Onun əzəmətinin və böyüklüyünün məqamıdır.

Beyt

“Misilsiz bir bağışlayan və əbədi bir cahandar,
Zavalsız bir sultan və daimi bir xudavənd.
O, elə bir hökmdardır ki, onun mülkü davamlıdır,
Və o, elə bir qadirdir ki, onun qüdrəti kamildir”.

Və ənbər mehli salavat cavahiratının ən parlaqları və gül qoxulu salam incilərinin ən gözqamaşdıranları olsun peyğəmbərlik divanının əmiri, ululuq eyvanının kürsüsündə oturan, “Qalx və xəbərdarlıq et!”[110] bostanının sərvi[111], “Öz Rəbbini uca tut!”[112] gülüstanının bülbülü, Allahın sevimlisi Əbül-Qasım Məhəmməd Rəsulullaha!

“Cah-calal dənizinin incisi Məhəmməd,
Onunla xətm oldu peyğəmbərlik hökmü.
O, “Gecə vaxtı seyr”[113] meydanının çevik süvarisi,
“Sənə zəfər bəxş etdik”[114] sahəsinin şücaətlisi,
Günahla dolu ümmətlərin pənahı,
“Ayaqlarından yaxalananların”[115] şəfaətçisi,
“İki kaman (yay) uzunluğu”[116] taxtının şahənşahı,
Tanrının sevimlisi və iki cahanın sultanıdır”.

Allahın salamı olsun ona və onun varisinə (vəsisinə) və dostuna (vəlisinə)![117] Və minlərcə dua olsun bədirlənmiş nurlu ağ aya, ucalıq sandığının gövhərinə, “Həl-əta” surəsinə[118] mövzu olan möminlərin əmiri və dindarların imamı Əli Mürtəzaya!

Nəzm

“Yaradılmışların imamı, gözəlliklərin məzhəri,
Allahın dostu, külli qaliblərin sərvəri olan Əli.
Onun pak ətəyindən yapışmışdır,
Həm fasiq rind, həm də tövbəkar şeyx”.

Bu sətirlərin müəllifi və Əmir sultan Rumlunun nəvəsi olan Həsən “Əhsənüt-təvarix”in on birinci cildini başlayır. [Bu cild] bəzi Rum[119] sultanlarının, əksər Cağatay[120], Qaraqoyunlu, Ağqoyunlu və Qaraman ailəsi[121] padşahlarının və onların müasiri olmuş məşhur alimlərin və şairlərin əhvalından ibarətdir.

---

[109] Bargah – farsca saray deməkdir. Yürüşlər zamanı padşahın və yüksək dövlət xadimlərinin çadırı da bəzən “bargah” adlanır. Burada məcazi mənada, İlahi dərgah anlamında işlənmişdir.

[110] *Qurani-Kərim, “Müdəssir” surəsi, 2-ci ayə.* Mətndəki “Quran” ayələri əsas etibarilə Z.Bünyadovun və V.Məmmədəliyevin tərcüməsi əsasında təqdim edilmişdir.

[111] Sərv – mülayim isti iqlimlərdə bitən hündür və həmişəyaşıl ağac növü. Burada ucalıq rəmzi kimi məcazi mənada işlədilmişdir.

[112] *Qurani-Kərim, “Müdəssir” surəsi, 3-cü ayə.*

[113] “Qurani-Kərim”in “İsra” surəsi nəzərdə tutulmuşdur. Burada Məhəmməd peyğəmbərin Allah-taala tərəfindən möcüzəvi bir şəkildə bir gecə Məscidül-Həramdan Məscidül-Əqsaya aparılıb oradan meraca qalxması hadisəsinə işarə edilmişdir.

[114] *Qurani-Kərim, “Fəth” surəsi, 1-ci ayə.*

[115] *Qurani-Kərim, “Rəhman” surəsi, 41-ci ayə* (günahkarlar haqqında nazil olmuşdur).

[116] *Qurani-Kərim, “Nəcm” surəsi, 9-cu ayə.* Mələk Cəbrayıl, Məhəmməd peyğəmbərə vəhy gətirərkən onların arasında məsafə “iki kaman (yay”) uzunluğunda” olmuşdur.

[117] Peyğəmbərin əmisi oğlu və kürəkəni, şiələrin birinci imamı Həzrət Əli nəzərdə tutulur.

[118] “Həl-əta” surəsi – “Quran”ın “İnsan” surəsidir. Şiələr bu surənin Həzrət Əli haqqında nazil olduğuna inanırlar.

[119] Səfəvi mənbələrində “Rum” və “rumi” adları altında Osmanlı dövləti və oranın əhalisi nəzərdə tutulur.

[120] Cağatay padşahları – bu ad altında əsərdə Teymuri hökmdarları başa düşülür.

[121] Qaraman ailəsi (Qaramanoğulları) – 1256-1474-cü illərdə Türkiyənin Nigde, Qaraman, Konya, İçil, Taşili və Alanya bölgələrində hökm sürən xanədan və bəylik (bax: *F.Sümer. Karamanoğulları // TDVİA, cilt: 24, yıl: 2001, s.454-460*).

## 807-Cİ İLİN (10.07.1404 – 28.06.1405) HADİSƏLƏRİ

### Şahrux sultanın Xorasan vilayətindəki səltənəti, o zamanın əhvalatlarının və hadisələrinin, dövran çaxnaşmalarının və qarışıqlıqlarının bəziləri haqqında söhbət

Cahan fatehi olan Sahibqiran Əmir Teymur Kürəkanın[122] vəfat xəbəri Xorasan[123] vilayətində Şahrux sultana[124] çatdıqda o, əzadarlıq mərasimindən sonra Tanrının qayğısı və əmirlərin razılığı ilə ramazan ayında (1405-ci ilin mart ayında) Xorasan səltənətinin taxtına oturdu. Hər şeyə qadir məlikin (Allahın) hüsn-rəğbəti ilə təqdir xəzinədarı səadət nişanlı ulduzları sikkə kimi şabaş edərək [göy üzünə] səpdi. Böyük seyidlərin və öndə gedən alimlərin tale çəməni fələyin qulamlıq etdiyi o hökmdarın ümumi ənam yağışından yaşıllaşdı və təravətləndi. Fəzilət və hünər sahiblərinin amal fidanı o həzrətin mərhəmət buludunun damlalarından böyüyüb Sidrətül-müntəhanı[125] keçdi.

O əsnada xəbər çatdı ki, Xəlil sultan[126] Səmərqəndi[127] ələ keçirmişdir və Əmir Teymurun xəzinəsinə yiyələnmişdir. Buna görə də o həzrət Əmir Mizrab Cakünü, Əmir Əleykə Kükəltaşı və Əmir Hüseyn Tərxanı[128] Xorasanı mühafizə etmək üçün təyin etdi və ondan sonra səadətli hökmdar həddən artıq ordu ilə Heratdan[129] Səmərqəndə doğru hərəkətə keçdi.

Nəzm

“Süleyman[130] kimi uğurlu Şahrux,
Onun dərgahının torpağına Cəmşid[131] üzünə sürtüb.
Səadətlə çıxdı Heratdan o,
Süleyman görkəmli, İsgəndər[132] sifətli.
Turan[133] niyyəti ilə yola düşdü o,
Düşüncədə qoca, bəxtdə cavan”.

Gözəl xasiyyətli hökmdar Doqquz-ribat (Tokuz-ribat)[134] mənzilindən Əmir Seyfəddinin oğlu Əmir Əbdüssəmədi Badğis[135] qoşununu çağırmağa göndərdi və Xızır Xoca ilə Şeyx Həsən Quçini Mavəraünnəhrin[136] əhvalını öyrənməyə yolladı. Zəngi dərəsi[137] mənzilində Şeyx Əli Bahadırın oğlu Əmir Seyid Xoca bir dəstə igidlə Mazandaran[138] tərəfdən gəlib o diyarın xəbərlərini ərz etdi. Məşvərətdən sonra o səltənət səmasının günəşi (Şahrux), Əmir Firuzşah Tərxanı Heratın bürc və divarlarını təmir etmək üçün geri göndərdi,

---

[122] Sahibqiran – orta əsr münəccimlərinə görə, Zöhrə və Müştəri ulduzlarının eyni bürcdə, eyni dərəcədə və eyni nöqtədə qovuşduğu uğurlu saatda anadan olmuş xoşbəxt şəxs. Bu epitet ilk dəfə Əmir Teymura aid edilmiş, daha sonra isə müsəlman şərqinin bəzi digər hökmdarları da bu epitetlə xatırlanmışlar. Kürəkan – Əmir Teymur, Çingiz xanın nəslindən olan Saraymülk xanımla evlənmiş və bu səbəbdən tarixdə “Kürəkan” (kürəkən) ləqəbi almışdır *(Doğuştan Günümüze Büyük İslam Tarihi. İlmi müşavir ve redaktör: H.D.Yıldız. IX. c. İstanbul, 1992, s.271-272).* Sonradan bu ləqəb Teymurilər xanədanının digər nümayəndələrinə də keçmişdir. Bəzi mənbələrdə Kürəkan ləqəbi təhrif olunaraq “Gürgan” şəklinə salınmışdır.

[123] Xorasan – indiki İranın şimal-şərq hissəsini, Mərv vahəsini, indiki Türkmənistanın cənub vahələrini və Əfqanıstanın şimal və şimal-qərb hissəsini əhatə edən tarixi vilayət.

[124] Şahrux – Əmir Teymurun oğludur.

[125] Sidrətül-müntəha – dini rəvayətə görə, göyün yeddinci qatında olan əfsanəvi ağac.

[126] Xəlil sultan – Əmir Teymurun nəvəsi və Miranşahın oğludur *(Nəvai, şərhlər, s.105).*

[127] Səmərqənd – müasir Özbəkistanda şəhər. Əmir Teymurun paytaxtı olmuş, onun ölümündən sonra da Teymurilərin siyasi mərkəzlərindən biri kimi önəmini qorumuşdur.

[128] Əmir Hüseyn Tərxan (“Mətləüs-səədeyn”də Əmir Həsən Sufi Tərxan) – Şahruxun həyat yoldaşı Gövhərşad xatunun qardaşıdır *(Nəvai, şərhlər, s.106).*

[129] Herat – müasir Əfqanıstanın şimal-qərbində şəhər. Bəhs edilən dövrdə Xorasanın mərkəz şəhəri və Teymurilərin əsas paytaxtı idi.

[130] Süleyman – qədim dövrün məşhur hökmdarlarından və peyğəmbərlərindəndir. Davud peyğəmbərin oğludur. M.ö. 965-935-ci illərdə hakimiyyətdə olmuşdur *(Y.Yusifov. Qədim Şərq tarixi. Bakı, 1993, s.223).*

[131] Cəmşid (Cəm) – Firdovsinin “Şahnamə” əsərində haqqında bəhs olunan qədim İranda hökmranlıq etmiş əfsanəvi Pişdadilər sülaləsinin dördüncü şahı (bax: *Əbülqasim Firdovsi. Şahnamə. Tərcümə edəni: M.Əlizadə. Bakı, 1987, s.31-39*).

[132] İsgəndər – qədim dövrün böyük fatehi Makedoniyalı İsgəndər. M.ö. 336-323-cü illərdə hökmranlıq etmişdir.

[133] Turan – Orta Asiya nəzərdə tutulur.

[134] Tokuz-ribat – Heratdan bir köç mənzili məsafədə idi *(Nəvai, şərhlər, s.132).*

[135] Badğis (Badxız) – Heratdan şimala doğru, müasir Türkmənistanın cənub-şərqində təpəlik bir bölgədir.

[136] Mavəraünnəhr – Orta Asiyada Amudərya və Sırdərya çayları arasındakı ərazilər.

[137] Zəngi dərəsi – Herat yaxınlığındadır *(Фасих Хавафи. Муджмал-и Фасихи / Фасихов свод. Пер., предисл., примеч. и указ. Д.Ю.Юсуповой. Ташкент, 1980, с.73).*

[138] Mazandaran – İranda, Xəzər dənizinin cənub sahillərində vilayət.

Əmir Seyid Xocanı isə Tus[139] qalasını sahmana salmaq üçün o tərəfə yolladı. Özü də şəxsən Bəhram[140] kimi qəhredici ordusunun qalan hissəsi ilə Mavəraünnəhrə doğru hərəkətə gəldi.

Ləngəri-Şeyxzadə Bayəzid [adlı yer] müzəffər məiyyətin gəlişinin təntənəsindən İrəm gülüstanına[141] həsəd bəxş etdikdə, Mirzə Sultan Hüseyn hüzura gəlib ali mənşəli padşahın nəzəri qarşısına çıxdı. O əsnada xəbər yığmaq üçün Səmərqəndə getmiş Xızır Xoca və Şeyx Həsən Quçin geri dönüb Xəlil sultanın səltənət taxtına oturduğunu ərz etdilər. O həzrət, Əmir Həmzə Qutuqunu elçi kimi Xəlil sultanın yanına göndərdi.

Ceyhun[142] sahili [dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin padşahının dayanacaq yeri olduqda Əmir Şahməlik Buxaradan gəlib şahzadələrin – Mirzə Uluğ bəyin və Mirzə İbrahim sultanın – salamat olduqlarını ərz etdi. O arada Xəlil sultanın elçisi gəlib o həzrətin dilindən itaətkarlıqdan ibarət məhəbbət dolu kəlmələrlə məruzə etdi. Buna görə də Şahrux padşah məiyyət və ordusu ilə geri döndü və övladlarını gətirmək üçün Əmir Şahməliki Buxaraya yolladı.

Əndixud[143] ətrafı müzəffər əsgərlərin dayanacaq yeri olduqda Mirzə Sultan Hüseyn səbəbsiz surətdə fərar etdi. Elə həmin vaxt Buxara əmirləri eşitdilər ki, Xəlil sultan çoxsaylı qoşunlarla Səmərqənddən çıxıb Ceyhun sahilində hökmdarlıq bargahının (çadırının) qübbəsini mavi göylərə qaldırmışdır. Bu müxaliflik ucbatından oranın (Buxaranın) hakimi Əmir Rüstəm Toğay Buğa Buxaranı tərk edib, Mirzə Uluğ bəylə Mirzə İbrahim sultanın üzəngisinin həndəvərində bol kədərlə Ceyhunu keçərək hökmdar ordusuna qoşuldu. Əmir Şeyx Nurəddin də qantökən qoşunu ilə orduya qatıldı və Əmir Əbdüssəməd Badğis qoşununu gətirib qələbə şüarlı orduya birləşdi.

O həzrət Dukədə cah-calalla dayandı. Dünya fatehi olan padşahın buyruğu ilə Əmir Şeyx Nurəddin həmin mənzildən Sultan Xəlilin yanına gedib, iki tərəfin ittifaqına nail olmaq üçün böyük səy göstərdi. Belə qərara alındı ki, Xəlil sultan Sahibqiranın xəzinələrinin bir qismini Pir Məhəmməd Cahangirin[144] yanına göndərsin və Mavəraünnəhr səltənəti ilə kifayətlənsin. Belə olduqda Şahrux sultan sülhə razı oldu.

O zaman Sahibqiran sultanın (Əmir Teymurun) Şam[145] yürüşündən qayıdarkən Rey[146] hüdudunda qoyduğu Əmir Süleymanşah, Mirzə Miranşahın ordusunun zərərindən qorxub hüzura gəldi. Eyni zamanda Sari[147] hakimi Əmir Pir Məhəmməd Şəngüm ulu orduya qoşulsa da, Əmir Süleymanşahın və Əmir Cahan Məlikin səyləri ilə öldürüldü. Həzrət Şahrux Herata yollandı. Zilqədə [ayının] 26-da (27.05.1405) misilsiz Herat şəhəri o fatehlik zirvəsinin günəşinin görünməsinin parlaqlığından asiman bürclərinə həsəd bəxş etdi.

### Seyid Xocanın Pirək padşahla və Sultan Əli Səbzəvari ilə müharibə etməsi haqqında söhbət

Əmir Seyid Xocanın Tusda olduğu zaman xəbər gəldi ki, Xoca Məsud Səbzəvarinin oğlu Xoca Sultan Əli[148] ayağını itaətkarlıq dairəsindən kənara çıxarmışdır. Ona görə də Əmir Seyid Xoca altı yüz nəfər yaxşı silahlanmış süvarini təcili olaraq Səbzəvar[149] tərəfə göndərdi. Sultan Əli də dilavərlik meydanının atlılarından iki yüz nəfəri onları dəf etməyə təyin etdi. Bəhrabad[150] nahiyəsində böyük bir döyüş baş verdi. Dö-

[139] Tus – İranın Xorasan tərəfində, Məşhəddən şimal-qərbdə yerləşən tarixi şəhər *(Seddon, şərhlər, s.258).*

[140] Bəhram – qan kimi qırmızı göründüyü üçün klassik Şərq ədəbiyyatında müharibə rəmzi sayılan Mərrix ulduzu (Mars planeti) həm də Bəhram adını daşıyırdı. Burada və əsərin bəzi başqa yerlərində "intiqamçı Bəhram", "qaniçən Bəhram" qeyd olunduğu zaman müharibə rəmzi olan Mərrix nəzərdə tutulur.

[141] Gülüstani-İrəm (İrəm bağı) – Şərq əsatirlərinə görə, qədim zamanlarda Hud peyğəmbərə qarşı düşmənçilik edən və Ad qövmündən olan Yəmən hökmdarı Şəddad cənnətə bənzətmək üçün misilsiz dərəcədə gözəl bir bağ saldırmış və bu bağa "Gülüstani-İrəm" adını vermişdi. Lakin bu, ona uğursuzluq gətirmiş və o, Allahın qəzəbinə gələrək həmin bağla birlikdə məhv olmuşdur. Gülüstani-İrəm "behiştə və cənnət bağına bənzər" mənasında işlədilir.

[142] Ceyhun – Amudərya çayının adlarından biridir.

[143] Əndixud qalası – indiki Əfqanıstanın şimalında, Bəlxdən qərbdə və müasir Əfqanıstan – Türkmənistan sərhədinin yaxınlığında yerləşən Əndxoy şəhəri zonasında idi.

[144] Əmir Teymurun oğlu Cahangirin oğlu Pir Məhəmməd nəzərdə tutulmuşdur *(Nəvai, şərhlər, s.107).*

[145] Şam – Suriya.

[146] Rey – Tehran yaxınlığında şəhər.

[147] Sari – İranın Mazandaran vilayətinin inzibati mərkəzidir.

[148] Xoca Sultan Əli Səbzəvari – Sərbədarlar xanədanının mənsublarından idi *(Nəvai, şərhlər, s.108).* Şiə məzhəbli Sərbədarlar Xorasanda baş qaldıran xalq üsyanı nəticəsində hakimiyyətə gəlmiş və 1337-1381-ci illərdə mərkəzi Səbzəvar olmaqla Sərbədarlar dövləti mövcud olmuşdur *(И.П.Петрушевский. Ислам в Иране в VII-XV вв. Ленинград, 1966, с.355).*

[149] Səbzəvar – İranda şəhər. Xorasanda, Nişapur şəhərindən 106 km. qərbdə yerləşir. Beyhəq nahiyəsinin inzibati mərkəzidir.

[150] Bəhrabad – İranın şimal-şərqində, Xorasanda, Çinaran şəhristanında kənd.

yüşdən və vuruşdan sonra cağatay ordusu qaçış yolunu tutdu. Səbzəvarlılar onları təqib edib bir çoxlarını qətlə yetirdilər.

Bu möhnətli xəbər Seyid Xocaya çatdıqda iki min adlı-sanlı süvari ilə Səbzvar üzərinə sürətli yürüş edib, Cacərm[151] mövqeyində səbzəvarlılarla döyüşərək onların bir qismini qətlə yetirdi və bir dəstə igidlə Məzinana[152] yönəldi. O diyarın qalasını da fəth edəndən sonra Səbzəvarı bir mərkəz kimi dövrəyə aldı.

O əsnada xəbər çatdı ki, Pirək padşah[153] bir dəstə bahadırla Mazandarandan Cüveyn[154] vilayətinə gəlmişdir. Əmir Seyid Xoca Səbzəvar ətrafından köç edib onları qarşılamağa tələsdi. Xoca Sultan Əli Səbzəvardan çıxıb Pirək padşaha qoşuldu. Hər iki tərəf vuruşmağa və döyüşməyə hazır oldular. Əmir Seyid Xoca mərkəzdə ("qəlb") yer tutdu. Əmir Mizrab sol cinahda ("cəvanğar") dayandı. Yüz Buğa və Şeyx Sultan bir dəstə igidlə sağ cinahda ("bəranğar") durdular. O tərəfdən Pirək padşah bir dəstə yolunu azmış adamla mərkəzdə, Xoca Sultan Əli sağ cinahda ("meymənə"), mazandaranlılar isə sol cinahda ("meysərə") dayandılar. İki tərəf bir-birinə həmlə etdi. Savaşın tozu yer üzündən mavi günbəzin (asimanın) zirvəsinə çatdı.

Beyt

"Yoxluq (fəna) tozu havanı o qədər qaraltdı ki,
Onun üzərində bir cahan bina etmək olardı".

Xoca Əli, Əmir Seyid Xocanın sol cinahını məğlub edərək qələbə bayrağını yüksəltdi. Əmir Mizrab isə Pirək padşahın sol cinahını darmadağın edib mərkəzə həmlə etdi və başçıların başlarını, bahadırların bədənlərini yerlə yeksan etdi.

Nəzm

"Başçıların başları torpağa düşdü,
İgidlərin böyürləri yarıldı".

Pirək padşah pərişan və üzüqara halda Mazandaran tərəfə qaçdı. Onun namərdliyini görən Xoca Sultan Əli də məcburiyyətdən qaçış yolunu tutdu. Əmir Seyid Xoca onları təqib edib o bədbəxtlərin çoxunu gedər-gəlməzə göndərdi. Onların bədənlərindən və başlarından quşlara ziyafət süfrəsi quruldu.

Nəzm

"Budaqdan meyvə töküldüyü kimi yerə çoxlu baş düşdüyündən,
Qarğanın və kərkəsin ruzisi bol oldu".

Əmir Seyid Xoca müzəffər və qalib şəkildə, qeyri-məhdud qənimətlərlə Tus tərəfə qayıtdı.

## Xorasan diyarında baş vermiş hadisələr və Mirzə Sultan Hüseynin Şahrux padşaha qarşı müxalifliyi haqqında söhbət

Əmir Teymur Kürəkanın ölümündən sonra ordunun arxasında olan Mirzə Sultan Hüseyn[155] müxalifliyə başlayıb, yanında olan ordunu pərakəndə edərək min süvari ilə sürətli yürüş etməklə Səmərqənd tərəfə tələsdi ki, özünü şəhərə salsın və səltənət bayrağını yüksəltsin. Orduda olan əmirlər bu hadisədən xəbər tutub Səmərqənd tərəfə tələsdilər və Mirzə Xəlil sultanın yanına qasidlər göndərib onu xəbərdar etdilər. Ona görə də Mirzə Xəlil sultan Xudadad Hüseyni ilə birlikdə hərəkət bayrağını Səmərqəndə doğru qaldırdı.

Əmir Şahməlik və Əmir Şeyx Nurəddin, Mirzə Xəlil sultanın səltənət xəbərini eşitdikdə şahzadəyə xatırlatdılar ki, səadətli Sahibqiranın vəsiyyətinə əsasən, Səmərqənd hakimliyi Cahangir oğlu Mirzə Pir Məhəmmədə çatmalıdır. Amma faydası olmadı. Mirzə Uluğ bəy, Mirzə İbrahim sultan, Əmir Şahməlik və Əmir Şeyx Nurəddin möhtərəm xatunlarla birlikdə Səmərqəndə yönəldilər. Qorçuq mənzilindən Əmir Şahməliki

[151] Cacərm – Xorasanda, İranın şimal-şərqində, Səbzəvar şəhərindən şimal-qərbə doğru yerləşən şəhər.

[152] Məzinan – Səbzəvardan qərb tərəfdə yerləşən bir kənd.

[153] Pirək padşah – moğol əmirlərindəndir, Çingiz xanın qardaşı Cuci Qasarın nəslindəndir. Onun babası Toğa Teymur Elxanilər dövlətinin əmirlərindən olmuş, Sultan Əbu-Səidin ölümündən sonra Azərbaycandan Xorasana gedərək orada hakimiyyəti ələ keçirmiş, lakin Sərbədarlar tərəfindən öldürülmüşdür. Toğa Teymurun oğlu Loğman padşah Cürcan hakimi olmuşdur. 1388-ci ildə Loğman padşah öldükdə onun oğlu Pirək padşah, Əmir Teymurun əmri ilə Cürcan hakimi təyin edilmişdir *(Nəvai, şərhlər, s.109).*

[154] Cüveyn – Səbzəvardan şimalda yerləşən bir şəhristan.

[155] Əmir Teymur Çinə yürüş üçün Otrar şəhərində 200 minlik ordu hazırladığı halda vəfat etmişdir. Onun ölümündən sonra şahzadələr və əmirlər Çin yürüşünün təxirə salınmamasını qərara alsalar da, həmin orduda olan Əmir Sultan Hüseyn öz qoşununu götürüb Səmərqəndə getdiyi üçün yürüşü dayandırmaq məcburiyyətində qalmışdılar. Əmir Sultan Hüseyn, Əmir Teymurun qız nəvəsi və Məhəmməd bəy Musa oğlunun övladıdır. Həmin zaman onun 25-dən artıq yaşı yox idi *(Nəvai, şərhlər, s.110-111).*

şəhərə göndərdilər. Adı çəkilən əmir Səmərqənd darvazasına çatdıqda şəhərin zəbt olunduğunu gördü. Çünki Arğun şah, Mirzə Xəlil sultanın vədlərinə aldanmışdı. Əmir Şahməlik Çahar-rahə (Dörd yol) darvazasına tələsdi. Hərçənd Arğun şaha "müxaliflikdən əl çək!" deyə nəsihət etsə də, o, [bunu] qəbul etmədi.

Şeir

"Nadana öyüd verməyin heç bir mənası yoxdur,
Çünki su üstündə nəsihət yazmaq olmaz.
Kar xoş avazdan nəsib ala bilməz,
Ölüyə təbibin əlacı fayda verməz".

Əmir Şahməlik qəm-qüssəyə yoldaş olub Ülyabad[156] səhrasında əzəmətli orduya qoşuldu və Arğun şahın müxalifliyini zati-alilərinə ərz etdi. Onlar da Əmir Şeyx Nurəddini göndərdilər ki, onun qədəmlərinin uğuru ilə şəhər fəth olunsun. [Lakin] Əmir Şeyx Nurəddin də bir iş görə bilməyib hökmdarın ordusuna qayıtdı.

O əsnada Rüstəm Toğay Buğa, Mirzə Xəlil sultanın yanından gəlib dedi ki, əmirlər və ordunun qalan hissəsi Mirzə Xəlil sultanın padşahlığını qəbul etmişlər. Ona görə də xatunlar Səmərqəndə getdilər. Əmir Şeyx Nurəddin və Əmir Şahməlik, Mirzə Uluğ bəy və Mirzə İbrahim sultanla birlikdə Buxaraya yönəldilər və o şəhəri zəbt etdilər.

Mirzə Xəlil sultan həddən artıq ordu ilə hərəkət bayrağını Səmərqənd tərəfə yüksəltdi. Əmir Arğun şah əyan-əşrəflərlə Kuhək[157] çayı kənarında Mirzə Xəlil sultanın ordusuna çatıb Səmərqəndin açarlarını təslim etdi. Ramazan [ayının] 16-da (18.03.1405) Mirzə Xəlil sultan Səmərqəndə daxil oldu. O, Mirzə Məhəmməd sultan ibn Cahangirin oğlu və Mirzə Pir Məhəmməd Vəliəhdin qardaşı oğlu olan Cahangiri xanlığa yüksəldib onun adını fərmanların və hökmlərin əvvəlində yazdı. Neçə gün boyunca Əmir Teymur Kürəkanın ruhunu rahatlatmaq üçün fəqirlərə və miskinlərə yemək verilməsi ilə məşğul oldu və mərhum Sahibqirana mərsiyə olaraq qəsidələr söyləmiş şairlərə çoxlu lütfkarlıq göstərdi.

### Sahibqiran Əmir Teymur Kürəkandan sonra Azərbaycan diyarında baş vermiş hadisələrin təsviri

Sahibqiranın ölüm xəbəri Azərbaycan diyarında Mirzə Ömərin qulağına çatdıqda o, öz adına sikkə kəsdirib xütbə oxutdu, Bağdadda və Diyarbəkrdə olan atasını və böyük qardaşını hesaba almadı.

Həmin qışda o, Qarabağda qışlaq edib, baharın əvvəllərində çoxlu ordu ilə hərəkət bayrağını Təbrizə doğru yüksəltmişdi. Yol əsnasında Əmir Cahanşah Cakunu göndərmişdi ki, Əlincəq[158] qalasını xarab etsin. Çünki Sahibqiran Azərbaycan vilayətini ona həvalə edən zaman Mirzə Ömərə buyurmuşdu ki, qalanı viran edərsən. Mirzə Ömər rəbiülaxir [ayının] 2-də (08.10.1404) saysız-hesabsız qoşunlarla Şənbi-Qazanda[159] dayandı və bir neçə gündən sonra Qarabağa yollandı[160].

O əsnada Əmir Cahanşah[161] azğın adamların təhriki ilə ramazan [ayının] 2-də (04.03.1405) Mirzə Ömərin dərgahına gəlib, Mövlana Qütbəddin Evbehini, Əmir Darab Quşçunu və Əmir Şeyx Məhəmməd Təvaçını[162] qətlə yetirərək pərdəsaraya yönəldi. Mirzə Ömər bir dəstə səf yaran bahadırı onun qarşısına göndərdi. Onların arasında böyük bir döyüş baş verdi. O əsnada Mirzə Ömərin mülazimləri dəstə-dəstə və qoşun-qoşun köməyə yetişdilər. Əmirlik sahibi olan cənab (Əmir Cahanşah) son dərəcə çarəsizlik və iztirabla idbar üzünü fərar vadisinə çevirdi. Əmir Əbdürrəzzaq və Aşiq onun ardınca gedib, həmin günün digər namaz vax-

---

[156] "Zəfərnamə"yə görə: "Əliabad" *(Nəvai, şərhlər, s.111).*

[157] Kuhək – Səmərqənddən şimalda axan çay.

[158] Əlincəq (Əlincə) qalası – Naxçıvan Muxtar Respublikasının Culfa rayonu ərazisində, Əlincə çayının sağ sahilində, eyni adlı dağın zirvəsində qala *(Naxçıvan Ensiklopediyası. I c. Naxçıvan, 2005, s.162-164).* Hazırda bu qalanın adı Əlincə kimi tələffüz edilməsinə və yazılmasına baxmayaraq, bir sıra tarixi qaynaqlarda, o cümlədən "Əhsənüt-təvarix"də Əlincəq şəklində qeyd olunmuşdur. Bəzi tədqiqatçılar bu ifadəni Alıncaq kimi də oxuyurlar.

[159] Şənbi-Qazan – Hülaku hökmdarı Qazan xanın (1295-1304) Təbrizin cənub-qərbində saldırdığı şəhərcik *(V.Z.Piriyev. Azərbaycan XIII-XIV əsrlərdə. Bakı, 2003, s.300).*

[160] Mirzə Ömər babası Teymurun ölüm xəbərini Qarabağda almışdı *(İ.Aka. Mirza Şahruh ve zamanı (1405-1447). Ankara, 1994, s.43).*

[161] Əmir Cahanşah Caku oğlu – Əmir Teymurun bacısı oğludur.

[162] Təvaçılar müharibə gözlənilən təqdirdə dövlətin tabeliyində olan əyalətlərə gedərək hərbi qüvvə toplayan əmirlər olmuşlar. Onlar döyüşçüləri səfərbər edir, ordunun haraya toplaşacağını bildirirdilər *(Ş.K.Məmmədova. "Xülasət ət-təvarix" Azərbaycan tarixinin mənbəyi kimi, s.61).* Təvaçıların başçısı "təvaçıbaşı" adlanırdı.

tında (ikindi çağında) Əmir Cahanşahı ələ keçirərək Mirzə Ömərin razılığını almadan qətlə yetirdilər. Mirzə Ömər camaatın gümanının əksinə olaraq, onun övladlarına mərhəmət göstərdi. Ertəsi gün ordu ilə Ucana[163] gəldi.

Bu əhvalatlar cərəyan edərkən Mirzə Əbu-Bəkr Bağdaddan Həmədan[164] yaylağına doğru yola çıxdı. O əsnada Əmir Hüseyn Barlas, Mirzə Əbu-Bəkrin yanından gəlib ərz etdi ki, o, itaət məqamındadır. Mirzə Ömər bəla əlamətli ordu ilə İraqa[165] yollandı. Şəvval [ayının] 20-də (21.04.1405) o, səadət və uğurla Sultaniyyə[166] çəmənində dayandı və öz ordugahı ətrafında xəndək qazdırdı. Mirzə Əbu-Bəkr ordusunu qoyub iki yüz cavanla namehriban qardaşının yanına gəldi və elə həmin gün dustaq edilib Sultaniyyə qalasına həbs edildi. Mirzə Ömərin fərmanı ilə Əmir Hüseyn Barlas, Mirzə Əbu-Bəkrin Gözəldərədəki[167] ordusunu mühafizə etdi. Mirzə Ömər zilqədətül-həram [ayının] əvvəllərində (1405-ci ilin may ayının əvvəllərində) Dərgüzin[168] və Həmədan tərəfə yola düşdü.

Öz oğlunun həbsi barədə xəbər tutan Mirzə Miranşah bol kədərlə Mazandarana yollandı. O əsnada xəbər gəldi ki, gürcülər Naxçıvana gəlib o diyarı qarət etmişlər və Əmir Bistam Cagirlü Şirvan padşahı Şeyx İbrahimlə müttəfiq olub, Cəmaləkə (?) hücum etmək niyyətindədir. Dərgah əmirləri və ordu başçıları ərz etdilər:

- Dövlət üçün faydalı olan budur ki, qoşunları özümüzdən uzaqlaşdırmayaq. [Qoşunlarımızın] hamısını üsyankarlardan birinin üzərinə yönəldək və onun işini bitirdikdən sonra digərlərinin üzərinə gedək.

Mirzə Ömər [bu təklifi] qəbul etməyib, Ömər Tabanı, Pir Hüseyn Çilləni və Təvəkkül Barlası müqayisəyəgəlməz ordu ilə gürcüləri dəf etməyə göndərdi, Əmir Sevincəki isə Sultan Əhməd Cəlairi dəf etməyə yolladı.

Gürcülər Ömər Tabana qalib gəlib onu Mərəndə[169] qədər qovdular. Onlar (Ömər Taban və adamları) pərişan və bədhal oldular. Mirzə Ömər, Sultan Səncəri bir dəstə adamla onların ardınca göndərdi ki, onları geri qaytarsın. Sultan Səncər Miyanə[170] hüdudunda Təvəkkül Barlasa yetişdi. Onları geri qaytarmaq mümkün olmadığından böyük bir döyüş baş verdi. Sultan Səncər yaralı və bədhal bir vəziyyətdə Mirzə Ömərin ordusuna qayıtdı.

### Alinəsəb Sahibqiranın ölümündən sonra Mirzə Pir Məhəmmədin, Mirzə Rüstəmin, Mirzə İsgəndərin halı və Şirazda baş vermiş hadisələr haqqında söhbət

Sahibqiranın vəfatı zamanı Mirzə Pir Məhəmməd Şirazı istila etmişdi. Qardaşı Mirzə Rüstəm İsfahanda səltənət bayrağını yüksəltmişdi. Mirzə İsgəndər isə Həmədanda hökm sürməkdə idi.

Sahibqiranın vəfatı xəbəri Mirzə Pir Məhəmmədə çatdıqda Bəyan Teymuru, Lütfullanı, Əmir Colbanşahı və digər ali məqamlı əmirləri toplayıb onlarla səltənət barəsində məşvərət etdi. Bəziləri dedilər:

- Misirdəki Abbasi xəlifələrindən[171] bir fərman gətirib moğol yasasını dəyişdirək.

Bir sıra başqaları ərz etdilər:

- Mirzə Ömərə tabe olmaq lazımdır.

---

[163] Ucan – Cənubi Azərbaycanda orta əsr şəhəri. Təbrizdən 50 km. cənub-şərqdə yerləşirdi. Hazırda Ucan, Şərqi Azərbaycan (Təbriz) ostanlığına daxil olan Bastanabad bəxşiliyində kənddir.

[164] Həmədan – Qərbi İranda şəhər. Orta əsr mənbələrinə görə, Həmədanla Dərbənd arasındakı ərazilər Azərbaycan adlanırdı *(Z.M.Bünyadov. Azərbaycan VII-IX əsrlərdə. Bakı, 1989, s.136)*.

[165] Orta əsrlərdə iki İraq (İraqeyn) mövcud idi: mərkəzi Bağdad olan Ərəb İraqı (İraqi-Ərəb) və mərkəzi İsfahan şəhəri olan Əcəm İraqı (İraqi-Əcəm).

[166] Sultaniyyə – Cənubi Azərbaycanın Zəncan şəhəri yaxınlığında Elxanilər dövründə salınmış orta əsr şəhəri. Hal-hazırda Zəncan – Qəzvin yolundan 6 km. cənubda yerləşən bir qəsəbədir.

[167] Gözəldərə – Zəncanın kəndlərindəndir *(Nəvai, şərhlər, s.113)*. Van gölü yaxınlığında da bu adda başqa bir yer vardır *(Seddon, şərhlər, s.259)*.

[168] Dərgüzin (Dərgəzin, Dərcəzin) – Həmədandan şimalda yerləşir.

[169] Mərənd – Cənubi Azərbaycanda, Təbrizdən 60 km. şimal-qərbdə, Xoy – Təbriz avtomobil yolunun kənarında yerləşən şəhər.

[170] Miyanəc (Miyanə) – Cənubi Azərbaycanda, Təbrizdən 175 km. cənub-şərqdə, Qızılüzən çayı kənarında yerləşən şəhər.

[171] 1258-ci ildə Hülaku xan Bağdadı tutaraq Abbasilər xilafətinin hakimiyyətinə son qoysa da, Abbasi nəslinin bəzi nümayəndələri Misir Məmlüklərinə sığınmış və onların himayəsi altında Abbasilərin xəlifəliyi, formal olaraq, 1517-ci ildə Osmanlı sultanı Yavuz Səlimin Misiri fəth etməsinə qədər orada davam etmişdir. Əmir Teymurun vəfatı zamanı Misirdəki Abbasi xəlifəsi əl-Mütəvəkkil idi *(Nəvai, şərhlər, s.115)*.

Başqa bir dəstə isə "Mirzə Miranşahı padşah etməliyik" dedi. Amma Mirzə Pir Məhəmməd bunları qəbul etmədi. Anası Milkət ağa[172] Şahrux padşahın xatunları sırasında qərar tapdığı üçün o, sikkə və xütbəni Şahrux padşahın adı ilə zinətləndirdi və bu yaxşı xidmətini bildirmək üçün Xorasana, Şahrux sultanın yanına iş bacaran elçilər yolladı. O həzrət elçilərə izzət və ehtiram göstərib onları geri göndərdi.

Bu əsnada Mirzə Pir Məhəmməd Fars[173] və İraqın pərakəndə olmuş köhnə sipahilərinin[174] hamısını toplayıb onlara ülufə[175] verdi və Kirmana[176], İdigü Barlasın[177] yanına elçilər göndərib onu itaətə dəvət etdi. Adı çəkilən şəxs qəbul etmədi.

O əsnada Mirzə Rüstəm İsfahandan və Mirzə İsgəndər Həmədandan bol peşkəşlə[178] Şiraza gəldilər. Mirzə Pir Məhəmməd onlara hörmət göstərdi. İki gündən sonra Azərbaycan tərəfdən casuslar gəlib xəbər gətirdilər ki, Mirzə Ömər, Mirzə Əbu-Bəkri tutub Həmədana yönəlmişdir. Mirzə Pir Məhəmməd Yəzd[179] hakimliyini Mirzə İsgəndərə həvalə etdi və Bəhram [kimi] intiqamçı əsgərlərlə İsfahan tərəfə yönəldi. Mirzə Pir Məhəmmədlə Mirzə Ömər arasında sülh bağlandı və Mirzə İsgəndər Yəzdə yollandı. Mirzə Pir Məhəmməd Şəbankarəyə[180] doğru hərəkətə gəldi. Yəzd ətrafında Mirzə İsgəndər, Mirzə Pir Məhəmmədin ordusuna qoşulub mənqəlay[181] qaydasında yola çıxdı. Yol əsnasında onlara həmlə etmək xəyalı ilə gəlmiş olan Kirman ordusu ilə döyüşüb bir çoxlarını qətlə yetirdi. Ona görə də İdigü Barlas, Əmir Nemətulla Kirmanini elçi sifəti ilə Mirzə Pir Məhəmmədin yanına göndərdi. Onun xatirinə Mirzə Pir Məhəmməd Şiraz tərəfə geri qayıtdı.

## Qara Osman Bayandurun Diyarbəkrdəki səltənəti haqqında söhbət

Dünyanın fatehi olan Sahibqiranın vəfatının xəbəri Diyarbəkrdə Qara Osmana çatdıqda Amidin[182] idarəçiliyini öz oğlu İbrahim bəyə həvalə edib, özü şəxsən nəfis vücudu ilə çoxlu qoşun və saysız məiyyət götürərək hərəkət bayrağını Mardin[183] tərəfə qaldırdı. Onların taxıllarını və məhsullarını [öz heyvanlarına] otlatdı. Çoxlu mallar qarət edib, Amidin səkkiz fərsəxliyində[184] yerləşən Saru qalasına[185] yönəldi, zor və güc yolu ilə qalanı tutub istila bayraqlarını yüksəltdi. O, bəzi kürdlərin hər il vergi ödəməsini qərarlaşdırdı.

## Rum diyarında baş vermiş hadisələr və İldırım Bayəzidin oğlu Əmir Süleymanın səltənətinin təsviri

İldırım Bayəzid bu kədər dünyasından əbədi aləmə köçdükdə onun beş oğlu qalmışdı: Əmir Süleyman, Sultan Məhəmməd, Sultan İsa, Musa Çələbi və Qasım Çələbi[186].

---

172 Mirzə Pir Məhəmmədin atası Ömərşeyx, Əmir Teymurun oğlu və Şahruxun qardaşıdır. O, cavan yaşında öldüyü üçün Əmir Teymur onun həyat yoldaşı Milkət ağanı Şahruxa ərə vermişdi *(Nəvai, şərhlər, s.116).*

173 Fars – İranda, mərkəzi Şiraz şəhəri olan tarixi vilayət.

174 Sipah – ordu, sipahi isə əsgər, hərbçi mənasındadır.

175 Ülufə və ələfə – ərəbcə "quru ot", "saman" sözündəndir. Orta əsrlərdə Azərbaycanda və Yaxın Şərqin bir sıra ölkələrində dövlət adamlarını, məmurları, elçiləri, çaparları ərzaqla, onların minik heyvanlarını isə yemlə təmin etmək üçün onların keçdikləri ərazilərdə kəndlilərdən ülufə və ələfə adı ilə vergi alınırdı *(И.П.Петрушевский. Очерки по истории феодальных отношений в Азербайджане и Армении в XVI – начале XIX вв. Ленинград, 1949, с.275-276; А.А.Али-заде. Социально-экономическая и политическая история Азербайджана в XIII-XIV вв. Баку, 1956, с.233-236).* Burada məvacib anlamında işlədilmiş ola bilər.

176 Kirman – İranın cənub-şərq hissəsində, Kuhrud silsiləsinin cənub qolu ilə Kuhbənan silsiləsi arasında yerləşən şəhər.

177 İdigü Barlas – Əmir Qiyasəddin Barlasın oğlu və Əmir Cakunun qardaşı oğludur. Əmir Teymur Müzəffərilərə qalib gələndən sonra onu Kirman hakimi təyin etmişdi *(Nəvai, şərhlər, s.116).*

178 Peşkəş – hökmdar bölgələrə səfərə çıxan zaman onu qarşılamağa gələn yerli feodallar, mülkədarlar şaha yerli əhali adından "payəndaz" və "peşkəş" adlanan hədiyyələr təqdim edirdilər.

179 Yəzd – İranda, İsfahanla Kirman arasında şəhər.

180 Şəbankərə – İranın Fars, Buşəhr, Kirmanşah və Xorasan (Məşhəd) vilayətlərində bu adda yaşayış məntəqələri vardır.

181 Mənqəlay – ordunun avanqard hissəsi.

182 Amid (Bizans dövründə Amida adlanırdı) – Diyarbəkr vilayətinin mərkəzi olmuşdur və hazırda Amid şəhərinin özü də Diyarbəkr adlanır. Bu şəhər qara daşdan tikildiyi üçün Qara Amid adlanırdı. "Əhsənüt-təvarix"in digər yerlərində və başqa tarixi mənbələrdə Hamid və Həmid şəklində də yazılmışdır *(Nəvai, şərhlər, s.117).* Türkiyənin Diyarbəkr şəhəri o zamanlar Ağqoyunlu bəyliyinin mərkəzi idi.

183 Mardin – Türkiyə ərazisində, Diyarbəkrdən cənub-şərq tərəfdə, indiki Türkiyə – Suriya və Türkiyə – İraq sərhədləri yaxınlığında yerləşən şəhər.

184 Fərsəx – təxm. 6 km-ə bərabər olan uzunluq vahidi.

185 Saru qalası – Amidin 8, Mardinin 5 fərsəxliyində yerləşirdi *(Nəvai, şərhlər, s.117).*

186 Əslində isə İldırım Bayəzid vəfat etdikdə Süleyman, Musa, İsa, Məhəmməd, Mustafa və Qasım adlı altı oğlu həyatda idi *(Osmanlı tarihi el kitabı. Editör: T.Gündüz. Ankara, 2013, s.43).*

Əli paşa, Ayna bəy Subaşı və Həsən ağa[187], Əmir Süleymanı səltənətə yüksəldib, Urumeliyə (Rumeliyə)[188] yönəldilər. Sultan Məhəmməd Amasyaya[189] gedib o diyarda yerləşdi. Sultan İsa hərəkət bayrağını Qaresi[190] elinə doğru qaldırdı. Musa Çələbi atasının yanında idi. Sahibqiran Əmir Teymur Kürəkanın buyruğuna əsasən, o, atasının cəsədini Bursaya[191] aparıb, onu əcdadlarının məqbərəsində dəfn edərək səltənət taxtına oturdu. Ondan sonra Qaresi elinə yönəlib, Sultan İsanı ələ keçirərək o biri dünyaya göndərdi.

O əsnada Əmir Süleyman böyük bir ordu ilə dəniz kənarına gəldi və öz qardaşı Qasım Çələbi ilə bacısı Fatimə xatunu İstanbul hakiminin[192] yanında girov qoydu. Ona görə də İstanbul hakimi onu dənizdən keçirdi. Əmir Süleyman Ədirnə[193] şəhərində səltənətə oturdu.

Onun taxta çıxması xəbəri Sultan Məhəmmədə çatdıqda, məşvərətdən sonra əmirlərin və dövlət ərkanının məsləhəti əsasında yaxşı nitq qabiliyyətinə malik elçilərini bol töhfələrlə Ədirnəyə göndərdi. Onlar Əmir Süleymanın taxtının ətəyinə gəlib, məhəbbət, dostluq, sevgi və ittihad izharından ibarət olan bir məktub təqdim etdilər. Əmir Süleyman da elçilərə çoxlu nəvaziş göstərib, Sultan Məhəmmədin övladlarına hörmət edərək onları elçilərlə birlikdə qardaşının yanına göndərdi.

## 808-Cİ İLİN (29.06.1405 – 17.06.1406) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### Şahrux sultanın əhvalının təsviri

Bu il xəbərçilər Şahrux sultana ərz etdilər ki, Mirzə Miranşah məiyyət və ordusu ilə Xorasana gəlməkdədir. O həzrət Əmir Süleyman Sufi Tərxanı, Əmir Cahan Məliki və Əmir Firuzşah Tərxanı beş min süvari ilə adlı-sanlı şahzadəni qarşılamağa göndərdi ki, əgər müxaliflik iddiasında olsa, ona hücum etsinlər və əgər uzlaşmaq üçün gəlmişsə, xidmətkarlıq vəzifəsini yerinə yetirsinlər.

Əmirlər məqsədə doğru hərəkətə keçdilər. Səbzəvarda Əmir Seyid Xoca da onlara qoşuldu. Birlikdə yola davam etdilər. Kalpuş yaylağında[194] Əmir Seyid Xoca və Əmir Mizrab [Miranşahın] hüzuruna çıxmaq şərəfinə nail oldular və Şahrux sultanın ismarışını çatdırdılar, Mirzə Miranşaha pənah aparmış Sultan Əli Səbzəvarinin [təslim edilməsini] istədilər. Onların istəyi yerinə yetirildi. Sultan Əli Səbzəvari və Pirək padşah onların pərişan dostları olan bir sıra azğınla birlikdə Əmir Seyid Xocaya təslim edildilər və əmirlər Xorasan tərəfə geri döndülər.

Bu il Mirzə Ömər, Həsən Təmurəci Bəhram [kimi] intiqamçı bahadırlardan [ibarət] bir dəstə ilə Əmir Bistamın üstünə göndərdi. Onlar Ərdəbillə Talış dağı arasında ona çatdılar. Böyük bir döyüş baş verdi. Həsən Təmurəc əsir düşdü. Mirzə Ömər, Əmir Bistamın qardaşı Mənsuru onu dəf etmək üçün göndərdi. Lakin o, düşmənçilikdən əl çəkib Əmir Bistama qoşuldu. Onlar Şirvan valisi Əmir Şeyx İbrahimin yanına getdilər və birlikdə Beyləqana yönəldilər. Mirzə Ömər tərəfindən o diyarın valisi olan Bəhrşah idbar üzünü fərar vadisinə çevirdi. Onlar o şəhərə basqın edib istila bayrağını yüksəltdilər.

### Mirzə Ömərlə Mirzə Əbu-Bəkrin əhvalı və onların bir-biri ilə düşmənçilik etmələri haqqında söhbət

Daha öncə qeyd edildi ki, Mirzə Ömər, Mirzə Əbu-Bəkri Sultaniyyə qalasında məhbus etmişdi. O əsnada Marağada[195] Dəli Bababəyi[196] adlı bir dərviş peyda olmuşdu. Ondan qeyri-adi əməllər baş verirdi. Məsələn, palçıq onun ovcunda qəndə və nabata dönürdü. Mirzə Ömər də onu müşahidə etmişdi. Buna baxmayaraq, onun qətlinə fərman verdi. Baba bu kədər dünyasından köçən vaxt dedi:

- Bizim alın yazımız buraya qədər imiş. Məndən sonra görəcəksiniz ki, nələr olacaqdır.

---

[187] Əli paşa vəziri-əzəm, Həsən ağa yeniçərilərin komandanı, Ayna bəy isə Qaresi subaşısı (hakimi) idi *(Nəvai, şərhlər, s.118).*
[188] Rumeli – Osmanlının Avropadakı əraziləri.
[189] Amasya – Türkiyədə, Yaşılirmaq çayının orta axarlarında yerləşən şəhər.
[190] Qaresi (Karesi) – XIII əsrin sonları – XIV əsrin birinci yarısında Anadolunun şimal-qərbində, mərkəzi Balıkəsir olan bəylik.
[191] Bursa – Anadolunun şimal-qərbində, Türkiyənin Mərmərə regionunda şəhər.
[192] İstanbul hakimi adı altında Bizans imperatoru II Manuil nəzərdə tutulmuşdur *(Nəvai, şərhlər, s.119).*
[193] Türkiyənin Avropa hissəsində şəhər. 1360-1453-cü illərdə Osmanlı dövlətinin paytaxtı olmuşdur *(Nəvai, şərhlər, s.118).*
[194] Kalpuş – İranın Simnan vilayətinin Meyami şəhristanındadır.
[195] Marağa – müasir İranın Şərqi Azərbaycan vilayətinin cənubunda şəhər.
[196] Nuruosmaniyyə nüsxəsi: "Baba Bəngi"; Paris nüsxəsi: "Baba Nik". Ə.Nəvai *(Şərhlər, s.121)* bu adı "Mətləüs-səədeyn" və "Mücməli-Fəsihi" əsərlərinə əsasən təshih etmişdir.

Məhərrəm [ayının] 17-də (15.07.1405), Babanın qətlindən üç gün sonra xəbər gəldi ki, Mirzə Əbu-Bəkr həbsdən xilas olub. Bu əhvalatın təfsilatı belədir ki, Mirzə Ömər, Mirzə Əbu-Bəkri qətlə yetirmək istəyirdi. Amma anasını düşünərək istəmirdi ki, bu iş açıq şəkildə baş versin və əmr etdi ki, ona içmək üçün zəhərli şərbət versinlər. Pis dadlı şərbəti adlı-sanlı şahzadənin yanına gətirdilər. Amma o, içməkdən imtina etdi. Bu işi törətməli olan Adil Xəzinəçi və İsa Qorçu, Mirzə Əbu-Bəkrin imtinasını məruzə etdilər. Fərman verildi ki, gecə vaxtı onu həlak etsinlər. Bir şəxs bu hadisənin mahiyyətini Mirzə Əbu-Bəkrə söylədi və bundan öncə Adil Xəzinəçinin mülazimlərindən biri ot-ələfin içində qılınc gizlədib Mirzə Əbu-Bəkrin yanına apardı. Həmin gün Adil və İsa, Mirzə Əbu-Bəkrin məclisində şərab içdilər ki, gecə olan kimi o yaramaz əməli icra etsinlər. Günün axırında nərd oynamaqla məşğul oldular. Mirzə Əbu-Bəkr fürsəti qənimət bilib, burnunun qanamasını bəhanə edərək evə daxil oldu və qılıncı ot-ələfin içindən çıxarıb, İsanı qətlə yetirərək Adilin sarayına yönəldi. Onu da öldürüb qalanı ələ keçirdi. Hər tərəfdən çoxlu adam onun yanına gəldi. Əmir Hüseyn Barlas, Mirzə Əbu-Bəkrin Gözəldərədə olan ordusunu onun yanına gətirdi. Mirzə Əbu-Bəkr hərəkət bayrağını Xorasana doğru yüksəltdi.

Mirzə Ömər bu möhnətli xəbəri eşitdikdən sonra iki gün içində Beşbarmaqdan[197] Sultaniyyəyə gəldi. O, Əmir Əbdürrəzzağı çoxlu qoşunla adlı-sanlı şahzadəni təqib etməyə göndərdi. Qəzvin ətrafında hər iki tərəfin igidləri bir-biri ilə ağır bir döyüş etdilər. Qalibi məğlubdan ayırmaq mümkün olmadı. Mirzə Əbu-Bəkr Reyə yollandı. Əmir Əbdürrəzzaq geri döndü.

Mirzə Ömər Sücas[198] yolundan Ucana getdi. Oradan Əmir Bistam Cagirlünü ələ keçirmək üçün Səraba[199] yönəldi. Əmir Bistam Qarabağ yolundan Şirvana getdi. Şirvan hakimi Şeyx İbrahim ona hörmət göstərdi. O iki sərdar izdihamlı qoşunlarla Kür çayından keçib Bərdədə dayandılar. Mirzə Ömər, Şeyx İbrahimə ismarış göndərib Əmir Bistamı ondan tələb etdi. Adı çəkilən şəxs (Şeyx İbrahim) belə cavab verdi:

- İndi yaydır. O həzrət qışda Qarabağa təşrif gətirəcəyi zaman Əmir Bistamı onun dərgahına göndərərəm.

Bu xəbəri eşitdikdə Mirzə Ömərin qəzəb atəşi alovlandı. O, Araz çayını keçib Babı Arğalıda[200] dayandı. Əmir Şeyx İbrahim, Şəki hakimi Seydi Əhməd, Qaraman oğulları və Əmir Bistam, Bəhram [kimi] intiqamçı igidlərlə Bərdədən Kür kənarına getdilər. [Orada] xəndək qazıb döyüşə və vuruşa hazırlaşdılar. Mirzə Ömər onların qarşısında yerləşdi. Yeddi gündən sonra xəbər çatdı ki, Mirzə Əbu-Bəkr və Mirzə Miranşah məiyyət və ordu ilə Xorasan hüdudundan qayıdıb Sultaniyyəyə doğru irəliləməkdədirlər. Digər tərədən, Mirzə Əbu-Bəkr, Araz Buğanın qızını istəmiş, Simnana[201] basqın etdikdən sonra Sultaniyyəyə gəlmiş və qala hakimi istehkamı təslim etmişdi. Mirzə Ömərin mülazimləri ondan üz döndərib Mirzə Əbu-Bəkrə qoşulmuşdular.

Mirzə Ömər bu xəbəri eşitdikdən sonra Şeyx İbrahim və Əmir Bistamla sülh edib Təbrizə yönəldi. O şəhərin rəiyyətindən iki yüz İraq tüməni[202] alıb Sultaniyyəyə yollandı.

O zaman Ömər Taban, Sultan Səncər və Əmir Əbdürrəzzaq oğlu Əmir Səid öz vəlinemətlərinin haqqını heçə sayaraq Mirzə Əbu-Bəkrə qoşuldular. Ömər Taban hüzura qəbul edilsə də, qalanları Mirzə Əbu-Bəkrin fərmanı ilə axirət aləminə göndərildilər.

Mirzə Əbu-Bəkr qızıl bir taxt hazırlatdırıb Mirzə Miranşahı oraya oturtdu. Mirzə Ömər Gavərud[203] tərəfdən Marağaya tələsib, Əmir Calıq Türkmanla, Salıq Barlasla və sulduz[204] camaatı ilə birlikdə Təbrizə

---

[197] Beşbarmaq – Həmədandan şimal-qərbdə yerləşən dağlıq bir ərazidir. İndi Pəncə-Əli adı ilə şöhrət tapmışdır *(Nəvai, şərhlər, s.122).*

[198] Sücas – Zəncan vilayətinin Qidar bölgəsinin bir nahiyəsidir *(Öztürk, şərhlər, s.130).*

[199] Sərab – Cənubi Azərbaycanda, Təbrizdən 124 km. şərqdə, Təbriz – Ərdəbil avtomobil yolu kənarında şəhər.

[200] Babı Arğalı – Füzuli rayonu ərazisində, Şeyx Babı Yaqub türbəsinin yerləşdiyi Babı kəndi və eyni rayonun ərazisindəki Əhmədalılar kəndi yaxınlğında yerləşən Arğalı türbəsi nəzərdə tutulur.

[201] Simnan – İranın şimalında, Tehrandan şərq tərəfdə, Elburz dağ silsiləsi ilə Dəşti-Kəvir səhrası arasında yerləşən şəhər.

[202] Tümən – monqolca "on min" deməkdir. 10 minlik pul vahidi, 10 min nəfərlik qoşun birləşməsi, bəzi hallarda isə inzibati vahid bildirən termin kimi istifadə olunmuşdur. Səfəvilər dövründə pul vahidi kimi 1 tümən 10 min dinara bərabər idi.

[203] Gavərud (Gavrud) – İranın Kürdüstan əyalətindədir.

[204] Sulduz – mənşə etibarilə Orta Asiyanın köçəri monqol-türk qəbilələrindən olan sulduzlar Çingiz xanın apardığı müharibələrdə yaxından iştirak etmişlər. Hülakular dövlətinin yaranmasından sonra sulduz qəbiləsi Urmiya gölünün sahillərində məskən salır *(V.Z.Piriyev. Azərbaycan XIII-XIV əsrlərdə, s.265).*

yönəldi. Mirzə Ömərdən əvvəl Salıq və Calıq cövşən[205] geymiş dilavərlərlə Təbrizə gəlib rəiyyətin mallarına əl uzatdılar. Şəhərlilər də onlara qarşı çıxmağa başlayıb, vergi toplamaq üçün gəlmiş Xoca Pir Əlini qətlə yetirdilər və küçələri bağlayıb (küçəbənd edib, barrikada qurub) döyüşə və vuruşa hazırlaşdılar. Mirzə Ömər şəhərlilərin yanına yaxşı nitq qabiliyyətinə malik adamlar göndərib sülhdən söz açdı. Təbriz camaatı dedi:

- Mirzə Ömər bizim şahzadəmizdir. Əgər şəhərə gəlsə, hakim olar. Amma türkmanları [şəhərə] buraxmarıq!

Mirzə Ömər türkmanlara savaş atəşini alovlandırmağı əmr etdi. Onlar döyüş iradəsi ilə küçəbənd (barrikada) üzərinə gəldilər. Qazı Qiyasəddin və Xoca Əbdülhəyy Qəzvini bir dəstə piyada ilə ürək deşən və can odlayan ox zərbəsi ilə qaragün türkmanları pərən-pərən saldılar. Bir neçə gün vəziyyət bu minvalla davam etsə də, itaət və tabeçilik xəyalları Təbriz camaatının ağlının ucundan belə keçmədi. O əsnada Mirzə Əbu-Bəkrin gəlişi xəbərinin doğru olduğu aydınlaşdı. Mirzə Ömər Marağa tərəfə qaçdı.

O əsnada Mirzə Əbu-Bəkr, Mirzə Miranşahı səltənətdən kənarlaşdırıb, özü padşahlıq taxtına əyləşdi. Əmir Bəyanı bir süvari dəstəsi ilə qabaqcadan Təbrizə göndərdi. [Şəhərin] avaraları və qara camaatı onun da daxil olmasına imkan vermədilər. Əmir Bəyan Şənbi-Qazanda yerləşdi. Bu arada kin meydanının iki min igidi ilə birlikdə Şeyx Qəbbani və Qazı İmadəddin, yanında dörd yüz nəfər olan Əmir Bəyanla döyüşüb məğlub oldular. Əmir Bəyan eşitdi ki, Şeyx Qəssab qara camaatdan ibarət bir dəstə ilə birlikdə vuruşmaq üçün gəlməkdədir. O, onlara sarı üz qoyub, iti qılınc zərbəsi ilə o bədbəxtlərin əksərini axirətə göndərərək Şənbi-Qazana qayıtdı.

Ertəsi gün Əmir Dolday, Mirzə Miranşahın[206] yanından gəlib dedi ki, Miranşahın şəhərə daxil olması yaxındır. Ona görə də müxaliflər öz müxalifliklərindən peşman olub əmirləri şəhərə gətirdilər. Əmir Dolday, Şeyx Qəssabla Xoca Əbdülhəyyi tutdu və onları cəzalandırmaq istədi. Əmir Bəyan imkan vermədi. Mirzə Əbu-Bəkr çoxlu ordu ilə cəmadiyülaxir [ayının] (24.11-23.12.1405) sonunda Təbrizə daxil oldu.

### Mirzə Ömər və Mirzə Rüstəmin Mirzə Əbu-Bəkrlə müharibə etmələri haqqında söhbət

Mirzə Ömər zəfər nişanlı əsgərlərin qorxusundan Marağanı qoyub, bol kədər içində Həmədan yolundan İsfahana getdikdə Mirzə Rüstəm ona izzət və ehtiram göstərdi. Ondan sonra həmin iki xoşbəxt bir-biri ilə ittifaq halında Savuxbulaq[207] tərəfə sürətli yürüş etdilər və o zaman Sarıqamışda olan Sultanbəxt bəyimi, Mirzə Miranşahın ailəsini və köçünü[208] götürüb geri qayıtdılar. Təvəkkül Barlas arxadan gəlib çoxlu döyüşdən sonra bir iş görə bilmədi. Onlar qənimətlərlə birlikdə sağ-salamat İsfahana gəldilər. Mirzə Ömər Şiraza yola düşdü. Mirzə Pir Məhəmməd ona böyük hörmət göstərdi və onlar birlikdə o şəhərdə qışlaq etdilər.

Ailəsinin və köçünün qarət edildiyi xəbəri Mirzə Əbu-Bəkrə çatdıqda Təbrizdən İsfahana doğru hərəkət bayrağını ucaltdı və Cürbadəqan[209] ərafında dayandı. O tərəfdən Mirzə Ömərlə Mirzə Pir Məhəmməd yağış damcıları qədər ordu ilə Mirzə Əbu-Bəkrin ordusunun iki mənzilliyinə gəldilər.

O əsnada xəbər çatdı ki, Əmir Bistam tam qələbəliklə Təbrizə irəliləməkdədir. Ona görə də Mirzə Əbu-Bəkr əhd-peyman bağlanması üçün şahzadələrin yanına qasidlər göndərib Azərbaycan tərəfə qayıtdı. Onlar elçiyə iltifat göstərməyib onun ardınca sürətli yürüş etdilər. Dərgüzin hüdudunda o iki qiyamət əlamətli qoşun bir-birinin qarşısında səf çəkdi. Hər iki tərəfin bahadırları qılınca və xəncərə əl atdılar. Almaza bənzər qılınclar bahadırların başını yarmağa və ölüm nişanəli oxlar əcəlin peyki kimi canların üzərinə yürüməyə başladı.

Nəzm

“Ovçu oxları ilə cəsur kişilər,
Özlərini savaş səflərinə vurdular.
Almaza bənzər qılıncın sərçeşməsindən,

---

205 Cövşən – zireh.

206 Ə.Nəvai *(Şərhlər, s.124)* burada Miranşah əvəzinə Mirzə Əbu-Bəkrin adının yazılmasını daha məqsədəuyğun hesab edir.

207 Savuxbulaq (Savucbulaq, Soyuqbulaq) – Cənubi Azərbaycanda, Urmiya gölündən cənubda yerləşən şəhər. Rey yaxınlığında da bu adda bir yer vardır.

208 “Mətləüs-səadeyn”ə görə, “Mirzə Miranşahın bir hərəmini” *(Nəvai, şərhlər, s.125)*.

209 Cürbadəqan (Cürbadqan, Cərfədqan) – Həmədanla İsfahan arasında yerləşən Gülpayəgan qəsəbəsinin adının ərəbləşmiş şəklidir.

Zireh qan dənizinə döndü".

Parlaq xəncər tozanağın qaranlığında çıraq kimi parlayır, atəşin şüası kimi tozun dumanından bərq vurur, zəmanə dikbaşlarının və dövran pəhləvanlarının başını bədəndən ayırır, mülk çəmənində düşmənlərin ömür fidanını kəsir, qanla yer üzünü lalə və ərğəvan[210] rənginə boyayır və sarı torpağı qırmızı rəngə çevirirdi. Göyün Nəsreyn ulduzları[211] ördək kimi qan gölünə qərq olmuşdu və asimanın Balıq [bürcü] qan dənizi üzərində üzürdü. O gün səhərdən axşamacan döyüş və vuruş atəşi son dərəcə alışdı və şöləndi. Belə ki, hər iki tərəfdən dörd min süvari və piyada qətlə yetirildi. Nəhayət, gecənin qara rəngli qarğası gündüzün gümüş simalı yanağını öz qol-qanadı ilə örtdü və qürub sağsağanı dünyanın çöhrəsini qır və qatranla boyadı.

Nəzm

"Zəmanə döndü məhşər gününə,
O zamana ki, günah məktubu oxunacaq.
Çatmadı gecənin zülmətindən,
Aşiqlərin ürəyindən dodağa ah.
Qaranlıq gecədə bu mübarək çöhrəli şah (günəş),
Mavi göydən aşağı endiyi zaman,
İgidlər dəmir libaslarını çıxardılar,
Gözətçilik üçün iki yüz göz zireh kimi oldu".

Səhər çağı hər iki ordu coşub-daşdı.

Nəzm

"Sərkərdələr bayraqları çəkdilər,
Məhşər gününün əlaməti peyda oldu".

Döyüş əsnasında Mirzə Əbu-Bəkr yeddi yüz nəfər yaxşı silahlanmış süvari ilə Mirzə Pir Məhəmmədin mərkəzinə həmlə etdi. Şahzadə ona tab gətirməyib İsfahan tərəfə fərar etdi. Mirzə Əbu-Bəkrin ordusu onları təqib edib bir çoxlarını qətlə yetirdi. Mirzə Əbu-Bəkr savaşda süstlük göstərdikləri üçün Ömər Tabanı, onun oğlunu və qardaşını gedər-gəlməzə göndərdi. Ona görə də Əmir Hüseyn Barlas fərar edib özünü İsfahana yetirdi.

Mirzə Əbu-Bəkr şəhərin bir fərsəxliyində dayandı və üç gündən sonra aləmi yandıran qoşunları ilə şəhər bağlarının olduğu yerə gəlib savaşa başladı. Şəhərlilər ox və sapand zərbələri ilə onları küçəbənddən (barrikdadan) uzaqlaşdırdılar. Ertəsi gün Mirzə Əbu-Bəkr bir dəstə əsgərlə ata minib, Küçəbağa daxil olaraq şəhər əhalisindən iki min nəfəri hiddətlə qətlə yetirdi və mötəbərlərdən üç nəfəri dustaq edib öz ordugahına qayıtdı.

İsfahanlılar bu savaşdan qorxaq-hürkək oldular. Onların ürəkləri şəhərin divarı kimi para-para və xarab, dodaqları fındıq kimi quru və susuz oldu. Gözlərindən Zindərud[212] kimi yaşlar axmağa başladı. Ona görə də aman diləyərək qəbul etdilər ki, Savuxbulaqdan gətirdiklərini geri versinlər və Miranşahın adına xütbə oxudub sikkə vurdursunlar. Mirzə Əbu-Bəkr qəbul etməyib yenidən savaşa başladı. Şəhərlilər bağları qoyub qalaya sığındılar. Mirzə Ömər başa düşdü ki, Mirzə Ömərşeyxin övladlarının Mirzə Əbu-Bəkrə qarşı müqavimət taqəti yoxdur. Buna görə də o, Şahrux padşaha xidmətkarlıq ehramını bağlayıb Xorasana yola düşdü.

O əsnada xəbər gəldi ki, Şeyx Hacı İraqi Sultaniyyəni mühasirə edib, Əmir Şeyx İbrahimlə Əmir Bistam isə Təbrizi ələ keçiriblər. Onların gəlişinin şərhi belədir ki, onlar Mirzə Əbu-Bəkrin İsfahanı mühasirə etdiyini eşitdikdə köçhaköçlə Təbriz ətrafına gəldilər. Mirzə Əbu-Bəkr tərəfindən o şəhərin hakimi olan Əmir Məhəmməd Dəvati, Əmir Bistamın yanına elçilər göndərib sülhdən söz açdı. Əmir Bistam bu sözə iltifat göstərməyib şəvval [ayının] 20-də (10.04.1406) səadət və uğurla Təbrizə daxil oldu və camaatla yaxşı davrandı. Lakin araqarışdıranların fəsadı nəticəsində Şeyx İbrahimlə Əmir Bistam arasında mübahisə tozu qopdu. Əmir Şeyx İbrahim, Əmir Bistamın qardaşlarını həbs etdi. Ona görə də adı çəkilən əmir (Bistam) Sə-

---

[210] Ərğəvan – qırmızı bir gül adı.

[211] Nəsreyn – iki Nəsr ulduzu nəzərdə tutulur. Bunların birinə Nəsri-vaqe, digərinə Nəsri-tair deyirlər. Bu iki ulduzun adı Avropa dillərində təhrif olunmuş şəkildə Vega və Altair adlanır *(Nəvai, şərhlər, s.126).*

[212] Zindərud (Zayəndərud) – İranın mərkəzindən axan, İsfahandan keçən bir çayın adıdır.

raba yönəlib, Məhəmməd Dəvatini, Şeyx Qəssabı, Xoca Şeyx Məhəmməd Dəməşqini[213] və Xoca Zeynəddin Qəzvinini özü ilə apararaq Ərdəbilə yollandı. Lakin Məhəmməd Dəvati və Xoca Şeyx Məhəmməd Dəməşqi ondan ayrılıb Şeyx İbrahimin yanına gəldilər və elə həmin gün həbs edildilər. Bu xəbər Mirzə Əbu-Bəkrə çatdıqda o, isfahanlılarla sülh bağlayıb Təbrizə hərəkət etdi.

## Xorasanda baş vermiş hadisələr və Əmir Süleymanşahın Şahrux padşaha qarşı müxaliflik etməsi haqqında söhbət

Daha öncə qeyd edildiyi kimi, Mirzə Sultan Hüseyn ordudan fərar edib, Amudərya (Amuyə) çayını keçərək Mirzə Xəlil sultanın adamları sırasına daxil oldu. O cənabın buyruğuna əsasən, o, bir sıra əmirlərlə çay qırağına getdi ki, o zaman Kabildən Bəlxə[214] gəlmiş Pir Məhəmməd Cahangir barəsində xəbərdar olsun. Lakin o, qəflətən səltənət arzusuna düşüb, Əmir Teymur Xocanı və Əmir Xoca Yusifi qətlə yetirərək digər əmirlərlə əhd-peyman bağladı və hərəkət yüyənini Səmərqəndə doğru çevirdi. Xəlil sultan bir dəstə bahadırla onu qarşıladı. Məhərrəm [ayının] 8-də (06.06.1405) Keş[215] nahiyəsində bir-biri ilə üz-üzə gəldilər. Səflərin tərtibindən, nizələrin və qılıncların işlədilməsindən öncə Əmir Allahdad, Arğunşah və digər yüksək məqamlı əmirlər ondan üz çevirib Mirzə Xəlil sultana qoşuldular. Mirzə Sultan Hüseyn qaçış yolunu tutub Əndixud və Şibirğanda[216] Əmir Süleymanşahla birləşdi. Onlar arasında sədaqət və ittihad yarandı. Qəflətən Mirzə Pir Məhəmməd onların üzərinə gecə basqını etdi. Sözügedən şəxslər fərar edərək Herata gəldilər. Həzrət Şahrux padşah, Əmir Süleymana[217] yüz min qəpik dinar ("dinari-kepeki") bağışlayıb onu Xorasana yolladı. O zaman Mirzə Miranşah Kalpuşda idi. Mirzə Sultan Hüseyni isə cəzaya (yasaya) çatdırdı (öldürdü).

Bu xəbər Əmir Süleymanşaha çatdıqda o, müxaliflik etməyə başladı və xəbər göndərdi ki, "əgər o həzrət Əmir Şahməliki Heratdan çıxarsa və Nuşirəvan Barlası qətlə yetirsə, onda tabe olaram". Ona görə də Həzrət Şahrux adamları və ordusu ilə hərəkət bayrağını Tus tərəfə qaldırdı. Əmir Süleymanşah o ali məqamlı padşahın qorxusundan Kəlat[218] qalasına sığındı. Hökmdarın məiyyəti yaxına çatdıqda Əmir Süleymanşah Səmərqənd tərəfə qaçdı. Buna görə də o həzrət Herat tərəfə döndü və Mirzə Uluğ bəylə Əmir Şahməliki Əndixudu zəbt etməyə göndərdi.

## Mirzə Pir Məhəmmədin Xəlil sultanla müharibə etməsi və bəzi əhvalatlar

Mirzə Uluğ bəylə Əmir Şahməlik Əndixud hüdudunda olduqları zaman Mirzə Pir Məhəmməd, Əmir Şahməliki yanına çağırdı və o cənab Bəlxə getdi. Onlar birlikdə Səmərqənd tərəfə hərəkətə gəldilər. Mirzə Uluğ bəy də onlara qoşuldu. Nəsəf[219] ətrafında iki qoşun qarşı-qarşıya gəldi. Xəlil sultan bir dəstə igidlə Mirzə Pir Məhəmmədin ordusunun mərkəzinə həmlə etdi və onları pərən-pərən saldı.

Nəzm

"Əgər sağlam bünövrəli dağ olsa belə,
Qiyamət gəldiyi zaman yıxılar.
Əgər əjdaha bir kəsin üstünə gəlsə,
O adam qaçmağa yer axtarar".

Mirzə Uluğ bəy və Əmir Şahməlik qoşunun tərtibinin pozulduğunu gördükdə naçar şəkildə Herat tərəfə fərar etdilər. Bu xəbər qurunun və dənizin padşahının (Şahruxun) qulağına çatdıqda Bəhram [kimi] qəhredici ordu ilə Mavəraünnəhrə yönəldi. Yol əsnasında Mirzə Uluğ bəy və Əmir Şahməlik hökmdarın ordusuna qoşuldular və döyüşün necə baş verdiyini açıqladılar. Elə bu zaman Mirzə Xəlil sultanın elçiləri gəlib,

---

[213] "Mətləüs-səədeyn"ə görə, Xoca Şeyx Məhəmməd Keçəçi *(Nəvai, şərhlər, s.127).*

[214] Kabil – müasir Əfqanıstanın paytaxtı. Bəlx – Amudərya çayından cənubda, Əfqanıstanın şimalında, Məzari-Şərif şəhərindən qərb tərəfdə yerləşən şəhərdir.

[215] Keş – Özbəkistanın Qaşqadərya vilayətində şəhər.

[216] Şibirğan – Əfqanıstanın şimalında, Əndixuddan (Əndxoy) cənub-şərqdə yerləşən şəhər.

[217] Əmir Süleyman və ya Əmir Süleymanşah – Əmir Davud Duqlatın oğlu və Əmir Teymurun qızı Sultanbəxt bəyimin əridir *(Nəvai, şərhlər, s.128).*

[218]Kəlat – İranda, Məşhəddən şimalda, Türkmənistan sərhədi yaxınlığında yerləşir.

[219] Nəsəf – Keş (Səbz) şəhərinin cənub-qərbində yerləşən bu şəhər həm də Nəxşəb adı ilə tanınırdı. Sonralar bu şəhər Qərşi adını qəbul etmişdir *(Nəvai, şərhlər, s.129).*

şahzadənin dilindən ərz etdilər ki, "Mirzə Pir Məhəmməd gözlənilmədən Amudərya çayını keçərək məmləkətimizə hücum etdiyi üçün naçar qalıb onu dəf etməklə məşğul olduq. İndi isə dostla bağladığımız köhnə əhdə vəfa etməkdəyik". Ali mənşəli hökmdar şəfqətli sözlər deyib Herat tərəfə qayıtdı.

Bu zaman Əmir Şahməlik əmirlərdən inciyib Bəlxə yollandı. Əmir Seyid Xoca[220] isə Əmir Əbdüssəməd, Tahir, Fazil[221] və Ucqara Bahadırın oğulları[222] ilə birlikdə müxaliflik etməyə başladı. Şam namazı vaxtında Cam[223] üzərinə getdilər. Həmin gecə ali bayraqlar onların ardınca hərəkətə gəldilər. Səhər çağı onlara çatdılar. Müxaliflər Həzrət Şahruxu görüncə atdan enib, üzlərini torpağa qoyaraq üzrxahlıq və yalvar-yaxar etmək üçün dilə gəldilər. O həzrət son dərəcə mürüvvətli olduğundan o tayfanın günahları üzərinə əfv fərmanı çəkərək, yüyəni dartıb geri döndü. Seyid Xoca öz tabeçiləri ilə birlikdə onu müşayiət edirdi. Ali mənşəli hökmdar Salar körpüsündə onlardan ayrılıb şəhərə daha əvvəl daxil oldu. Əmir Seyid Xocanın tərəfdarı olan bir sıra əmirlər dedilər ki, "cəfa toxumu səpib vəfa xırmanı gözləmək və nifaq fidanı əkib dostluq meyvəsi istəmək ağılsızların işidir".

Nəzm

"Əbucəhl qarpızı (acıxiyar) əkəndə bilmirdinmi ki,
Ondan şəkər qamışı biçməyəcəksən?!
Alçaq adamdan alacağın padzəhər yardımı,
Hər istifadədə canını alar".

Ona görə də Tusa qaçdılar. Həzrət Şahrux padşah onların ardınca irəlilədi. Seyid Xoca Astarabad[224] tərəfə hərəkət etdi. Həzrət Şahrux padşah Səməlqanda[225] dayandı. Əmir Şahməlik Bəlxdən gəldi və hüsn-rəğbətlə qarşılandı. Mirzə Ömər də dərgaha gəldi. O həzrət bir dəstə igidlə hərəkət bayrağını Astarabad tərəfə qaldırdı və o tərəfdən də Seyid Xoca çoxlu qoşunla göründü. Pirək padşah mərkəzdə ("qəlb"də), Şəmsəddin [ibn] Ucqara sağ cinahda (meymənə) və Əmir Seyid Xoca sol cinahda (meysərə) meydana çıxdı. Şahrux padşah onların qarşısında səf çəkdi. Sol cinahdan (cəvanğar) Mirzə Ömər və sağ cinahdan (bəranğar) Mirzə Uluğ bəy müxaliflər üzərinə at çapdılar.

Nəzm

"Sürətlə düşmənlərin üzərinə çapdılar,
Müxalifət binasını yıxdılar".

Onlar da qarşıdurma və vuruşma qədəmini önə qoydular.

Nəzm

"Kamanlardan [ox] atdılar və döyüşmək üçün
İti qılınc vurdular bir-birinə.
Baş yaran qılıncın zərbəsi ilə,
Dəvənin ayağı kimi parçalandı döyüşçünün kəlləsi".

Əmir Əli Tərxan bir dəstə igidlə mərkəzdən ("qol"dan) çıxıb, ayağını önə qoyaraq şiddətli bir döyüş etdi. "Kömək ancaq Allahdandır"[226] [ayəsinə] əsasən, fəth və zəfər yeli o həzrətin bayrağının pərçiminə əsdi. Pirək padşah yüz həsrət və ah ilə özünü Xarəzm[227] tərəfə çatdırdı. Seyid Xoca məğlub və pərişan halda Farsa tələsdi. Mazandaran vilayətinin hamısı Şahrux sultanın hakimiyyəti altında qərar tutdu və Seyid İzzəddin Həzarcəribi öz qardaşını onun hüzuruna göndərdi. O həzrət (Şahrux) Mövlana Cəlaləddin Lütfulla Sədri elçi kimi Sariyə yolladı və Astarabadın idarəçiliyini Mirzə Ömərə həvalə edib Herat tərəfə qayıtdı.

---

[220] Şeyx Bahadırın oğlu Əmir Seyid Xoca – Şahruxun əmirülümərası idi və ona qarşı üsyan qaldırmışdı *(Nəvai, şərhlər, s.131).*
[221] Bu üç nəfər Əmir Seyfəddinin oğulları idilər *(Nəvai, şərhlər, s.130).*
[222] Ucqara Bahadırın oğulları: Şəmsəddin, Şirəli və Müslim *(Nəvai, şərhlər, s.130).*
[223] Cam – İranda, Xorasanda şəhər. İndiki adı Türbəti-Camdır.
[224] Astarabad – İranın şimalında, Xəzər dənizindən 36 km. şərqdə yerləşən şəhər.
[225] Səməlqan (və ya Səmənqan) – Cacərmin şərqində bir bölgə *(Nəvai, şərhlər, s.131).*
[226] *Qurani-Kərim, "Ali-İmran" surəsi, 126-cı ayə.*
[227] Xarəzm – Orta Asiyada, Amudərya çayının aşağı axarlarında tarixi vilayət. Hal-hazırda bir hissəsi Özbəkistana, bir hissəsi isə Türkmənistana daxildir.

## 809-CU İLİN (18.06.1406 – 07.06.1407) HADİSƏLƏRİ

### Mirzə Ömərin Şahrux padşahla müharibəsi

Mirzə Ömər Mazandaranda Şahrux sultanın əmri ilə məskunlaşdıqdan sonra Rey tərəfə bir ordu göndərib, Mirzə Əbu-Bəkrin ağruqu[228] ilə birlikdə olan iki min moğol ailəsini köçürərək Mazandarana gətirdi. Elə bir ordu topladı ki, fələyin əjdahası onların oxlarının qorxusundan tısbağa kimi başını qalxanın içinə soxardı və göy üzünün aslanı onların öküz başına bənzər gürzləri qarşısında tülkü kimi qaçmağa üz qoyardı. O, bu ordu ilə Xorasanı zəbt etməyə yollandı.

Tusa çatdıqda Şeyx Möhyəddini görməyə getdi. Ona dedi:

- Ya şeyx! Dua et ki, Tanrı mənə Şahrux qarşısında zəfər bəxş etsin.

Şeyx cavab verdi:

- Mən əsla belə bir dua etmərəm. Çünki Şahrux ədalətli və Allahdan qorxan bir padşahdır. Sən isə qaniçən və qorxusuz birisən.

Mirzə Ömər qəzəblə dedi:

- Məni necə görürsən?

Şeyx dedi:

- Sən elə bir məxluqsan ki, qüvvətdə hamıdan aciz və cəhalətdə hamıdan üstün, ölümdə hamı ilə bərabər və qiyamətdə hamıdan rəzil. Səni belə görürəm.

Şahzadə istədi ki, şeyxə əziyyət etsin. Lakin sonra düşündü ki, “qarşımda böyük bir iş var. Əgər mənə qələbə nəsib olarsa, onda bilərəm ki, dərvişlərin himmətinin heç bir təsiri yoxdur. Əgər məğlub olsam, onda doğru sözdən nə üçün inciyim ki?!”. O, şeyxin hüzurundan çıxdı. Müridlər[229] dedilər:

- Əgər Mirzə Ömər qalib gəlsə, biz Xorasanda qala bilmərik.

Şeyx buyurdu:

- Əgər Xorasanda qala bilməsək, İraqda qalarıq.

Əmir Şahməlik Tus vilayətində Mirzə Ömərin gəlişindən xəbərdar olub şimşək və külək sürətində bir qasidi Herat tərəfə göndərdi və Şahruxu agah etdi. Bu üzdən ali məqamlı hökmdar Bəhram [kimi] intiqamçı ordu ilə Cama hərəkət etdi. Şənbə günü, zilqədə [ayının] 9-da (17.04.1407)[230] o iki qiyamət əlamətli qoşun bahar buludu kimi coşqun və hay-küylü bir şəkildə bir-birinə çatdı. Bahadırların həmləsinin küləyindən döyüş alovu alışdı. Mürğab[231] çevrəsində [Mirzə Ömər] Əmir Mizrabın mülazimlərinin əlinə düşdü. Başı yaralı və ayağı bağlı şəkildə onu ali orduya gətirdilər. O həzrət (Şahrux) mərhəmətinin bolluğu üzündən onu bağışladı. Şahzadə Doqquz-ribata (Tokuz-ribat) çatdıqda vəfat etdi və İmam Fəxrəddin Razi[232] məzarının yanında dəfn edildi.

### Diyarbəkrdə baş vermiş hadisələr, Qara Osmanın Kürdüstan[233] üzərinə qoşun çəkməsi, Çəküm və Mardin sultanı ilə müharibə etməsi

Bu il Qara Osman zəfərə yaxın olan ordu ilə Mardinə yollandı. Yol əsnasında Kürdüstanı çalıb-çapıb istila bayrağını yüksəltdi. Ona görə də Mardin sultanını[234] böyük bir qorxu bürüdü. O, Dəməşqin, Hələbin, Hümsün[235], Həmanın[236], Trablüsün[237], Malatyanın[238] və Divrigiyə[239] qədərki ərazilərin hakimi olan Sultan

[228] Ağruq – türkcə “ağır”, “ağırlıq” sözündən yaranmışdır və ordunun yüklərini bildirən termindir.
[229] Mürid – hər hansı bir təriqət şeyxinin, mürşidin tərəfdarı, ardıcılı.
[230] Şənbə günü miladi təqvimlə 16 aprelə təsadüf edir.
[231] Mürğab – Əfqanıstanda və Türkmənistanda çay adı.
[232] İmam Fəxrəddin Razi görkəmli islam alimlərindəndir, bir çox əsərlər yazmış və h. 606 / m. 1209-10-cu ildə Heratda vəfat etmişdir *(Nəvai, şərhlər, s.134)*.Şahzadənin bağışlandıqdan az sonra qəflətən vəfat etməsi onu göstərir ki, bəlkə də, Şahrux onu səmimi olaraq əfv etməyibmiş.
[233] Əsərdə Kürdüstan ifadəsi heç bir siyasi mahiyyət kəsb etmir və kürdlərin kompakt şəkildə yaşadıqları əraziləri ifadə etmək üçün işlədilir.
[234] Mardin sultanı – Mardindəki Artuklu bəyliyinin başçısı Məcdəddin İsa nəzərdə tutulur. Artuklu xanədanı türk mənşəli olub, 1102-1409-cu illər arasında hakimiyyət sürmüşdür *(C.Alptekin. Artuklular // TDVİA, cilt: 3, yıl: 1991, s.415-418)*.
[235] Hümüs – Suriyanın qərbində, Dəməşqlə Hələb arasında şəhər və vilayət mərkəzi.
[236] Həma – Suriyanın qərbində, Hümüs şəhərindən şimalda yerləşir.

Çəkümün yanına elçilər göndərdi və Diyarbəkr məmləkətinin gəlinini onun gözündə gözəl göstərməyə çalışıb səmimiyyət və sədaqət dili ilə ərz etdi: “Diyarbəkrdə hökumət bayrağını ucaltmış Qara Osman Türkmanın gözü özündən başqasını görmür. Yalnız zati-alilərinizin bəndələri [onun üstünə] yürüş edərlərsə, o zaman məğlub olar və Diyarbəkr vilayətinin gülzarı avara və sərgərdan türkmanların tüğyan tikanından təmizlənər. Əgər onun imarətinin bünövrəsini sökməyə və onun yaramaz tərəfdarlarının yox edilməsinə iltifat göstərməsəniz, tezliklə onun fitnə-fəsadının iyi Şam əhlinin burnuna və onun niyyətlərinin tüstüsü o hüdudun əhalisinin beyninə yetişəcəkdir”.

Bu söhbətin nağdı o ali mənşəli sultanın könül məhəkində tam əyarlı çıxdı (ürəyincə oldu). Digər bir səbəb isə o idi ki, inallu və bayat [tayfalarından] bir dəstə ondan üz çevirib fərar edərək Qara Osmana birləşmişdilər. O, onların [geri verilməsini] istəsə də, bu istəyi qəbul edilməmişdi. Ona görə də çoxlu qoşun toplayıb, öz atlarının ayaqlarından qalxan tozla asimanın aynasını qaraldan və öz əsləhələrinin parlaqlığı ilə ayın və günəşin gözünü qamaşdıran bir ordu ilə cilovunu boşlayaraq köçə-köçə qiyamət günü kimi Diyarbəkr hüduduna gəldi və Mardində dayandı. O zaman iki qəribə hadisə baş verdi.

Biri odur ki, Mardin sultanı bu vaxt onun düşərgəsinə gəlmək istədi. Onun (Mardin sultanının) yanında çox məharətli bir münəccim vardı. [Münəccim] onu oraya getməkdən çəkindirsə də, sultan onun sözünə əhəmiyyət verməyib ata mindi və münəccimin cavabında dedi:

- Bir halda ki Çəkümü mən çağırmışam, necə ondan uzaq durum və bir kənara çəkilim?!

O münəccim, sultanın [atının] yüyənini tutub onu geri döndərmək istədi. Sultanın məlikülümərası[240] olan Hacı Fəyyaz münəccimə qəzəbləndi və dedi:

- Sən kimsən ki, sultanın yüyənini tutursan və onu görmək istədiyi işdən çəkindirirsən?!

Münəccim dedi:

- Mən sizin üçün bunu faydalı bilirəm. İndi ki qəbul etmədiniz, onda tezliklə özünüzün və Sultan Çəkümün həlakını müşahidə edəcəksiniz.

Onun dedikləri düz çıxdı.

Digər [qəribə hadisə] isə o idi ki, Sultan Çəküm Mardin sultanının gəlişindən, Kürdüstan və Diyarbəkr əmirlərinin toplanışından sonra ata minmək vaxtında fala baxmaq üçün əlindəki aşığı göstərib söylədi:

- Bu aşığı təbilin üzərinə atacağam. Əgər çəkə, bəkə, alçu və duxan[241] gələrsə, zəfər bizimdir. Və əgər onba [gələrsə], zəfər Qara Osman bəyin olacaqdır.

Aşığı atdıqda onba gəldi.

Nəzm

“Oyuncaqdan çıxan hər fal,
Ulduz kimi göründü və doğru çıxdı”.

O fala rəğmən [qəflət yuxusundan] oyanmadı və hərb etməyə getməkdən daşınmadı. Çünki biləyinə olduqca çox güvənirdi. Dövran bahadırlarının və zəmanə igidlərinin məclisində qoçaqlıqdan dəm vururdu və deyirdi:

- Kaş ki, Qara Yusif Türkman, Qara Osman və Nasirəddin Zülqədər[242] birləşib mənimlə savaşsaydılar və mənim gücümü görsəydilər.

Qara Osman istədi ki, Qaracadağın[243] ətəyində, Axmadaş deyilən möhkəm (istehkamlı) bir yerə arxasını dayasın. Lakin əmirlər mane oldular. Axırda Həmid qalasına[244] pənah apardı. Sultan Çəküm Mardin sultanı, Kürdüstan sərdarları və bəzi Diyarbəkr əmirləri ilə ittifaqda tirkeş[245] bağlamış yeddi min qulamla gəlib

---

[237] Trablüs – Livanın Tripoli şəhəri.
[238] Malatya – Türkiyədə, Fərat çayından qərb tərəfdə şəhər.
[239] Divrigi – Türkiyənin Sivas vilayətindədir.
[240] Məlikülümərə - əmirlərin başçısı.
[241] Aşıq-aşıq oyununda atılan aşığın düşdüyü vəziyyətləri bildirən ifadələrdir.
[242] Nasirəddin Zülqədər – Türkiyənin Məraş və Əlbistan bölgələrində hökm sürən Zülqədər bəyliyinin başçısı.
[243] Qaracadağ – Türkiyənin Şanlıurfa vilayətinin Siverek ilçəsindədir.
[244] Həmid (əslində Amid) – Diyarbəkrin mərkəzinə verilən ad. Qala divarları qara daşdan tikildiyi üçün ona Qara Həmid və ya Qara Amid də deyərdilər.
[245] Tirkeş – ox qabı.

yetişdi. Onlardan beş min nəfəri dəmirə (zirehə) qərq olmuşdu. Onun yanında çoxlu tüfəng və top vardı. Bundan öncə tüfəng yox idi.

Tüfəngin peyda olmasının səbəbi odur ki, Firəng[246] diyarındakı Fransa ölkəsində Frey Bedre adlı rahib qoturluq xəstəliyinə tutulmuşdu. Hər nə qədər müalicə etsələr də, faydası olmurdu. O zaman onun yanına bir dərviş gəlib dedi:

- Əgər bu xəstəlikdən nicat tapmaq istəyirsənsə, bir qədər şoran torpaq götür və onu kükürdlə, kömürlə qarışdırıb, həvəngdəstə ilə döy! Daha sonra onu atəşə atıb, özünü onun buxarına tut! Bu xəstəliyin sağalmasının əlacı budur.

Frey Bedre bunu əmələ gətirdi və bır sıra keşişlərin hüzurunda onu atəşin üstünə tökdü. Ondan bir şölə sıçradı. Dedilər ki, bundan savaş silahı düzəltmək olar. Barıtı padşahın yanına apardılar. O, barıtı qamışın içinə qoydu. Od vurduqları zaman qamış yarıldı. Qamışın əvəzinə onu dəmirin içinə qoydular. Onu da yardı. Kükürdün miqdarını bir qədər azaltdıqda istədiklərinə nail oldular və ondan sonra tədricən top və badlic[247] də peyda oldu[248].

Qara Osman az adamla onların qarşısında səf tərtib etdi. Qara Osmanın oğlu İbrahim bəy bahadırlıqda məşhur idi və onun şücaətinin sorağı ətrafa yayılmışdı. Sahibqiran Əmir Teymur Kürəkan ona böyük qayğı göstərmişdi. Çəkümün yanında Bəyanoğlu adlı birisi vardı. O, əvvəllər Mardin sultanının nökəri olmuş, sonradan İbrahim bəyin mülazimi olmuş, daha sonra isə onun yanından qaçıb Sultan Çəkümə qoşulmuşdu. İbrahim bəyə hücum etmək istəyən Çəküm onun nişanələrini və dayandığı yeri Bəyanoğludan soruşdu. Qara Osman onu sol cinaha təyin etmişdi. Lakin daha sonra onun yaxşılığını istəyənlərin məsləhəti ilə belə qərara gəldi ki, düşmən qoşunu güclü və onların təchizatı bol olduğu üçün onu özünə yaxın etsin. Onun çağırılmasına göstəriş verdi və İbrahim bəy xüsusi (xassə) nökərlərindən otuz nəfərlə dayandığı yerdən çıxıb uca rütbəli atasına tərəf üz qoydu. O, həmin məsafəni qət edərkən Bəyanoğlu onu Çəkümə nişan verdi. Çəküm özünün bahadırlar dəstəsini yanına alaraq, külək rəftarlı qara ayğırına minib İbrahim bəyin üzərinə çapdı. O da yanındakı məhdud dəstə ilə müdafiəyə və qarşıdurmaya üz qoydu. Böyük bir döyüş baş verdi. Sultan Çəküm əfi ilan görkəmli nizəsi ilə İbrahim bəyi yəhərin üzərindən yerə saldı.

Beyt

“Əcəl iti nizənin ucunda,
İlanın dişindəki zəhər kimi gizlənmişdi”.

Və ruhunu şərəfli bədənindən ayırdı. Bu halı müşahidə edən Qara Osmanın ürəyinə od düşdü. O, İbrahim bəyin nökərləri ilə birlikdə onlara həmlə etdi. Qara Osman, Çəkümün hülqumuna bir ox vurdu. İbrahim bəyin nökərləri də onun iki qaşının arasına bir ox vurub Çəkümü izzət atından zillət torpağı üzərinə saldılar və bədənini baş yükündən azad etdilər. Başını nizənin ucuna taxdılar və onun atı qaçıb qoşununa sarı üz tutdu.

Ondan sonra bu halı müşahidə edən Kürdüstan əmirləri və Mardin sultanı birdən qaçmağa üz qoydular. Qara Osman bir dəstə türkmanla onları təqib edib Mardin sultanını və Hacı Fəyyazı iki ağızlı qılıncın zərbəsi ilə yoxluq sərhədinə çatdırdı (öldürdü) və hərəkət bayrağını Mardinə doğru qaldırdı. O diyarın əhalisi Mardin sultanının kürəkənini[249] səltənətə əyləşdirib inadkarlıq və təkəbbür mövqeyini tutdular. Ona görə də Qara Osman mühasirəni tərk edib Ruhaya (Urfaya)[250] yola düşdü və oranın qalasını zor və güc yolu ilə tutub, Yağmur bəyə[251] həvalə edərək Amid tərəfə qayıtdı.

**Mirzə Qara Yusif Türkmanın əhvalı və onun Azərbaycan diyarını ələ keçirməsi haqqında söhbət**

Qara Yusif Türkman və Sultan Əhməd Cəlair, Sahibqiran Əmir Teymur Kürəkanın qan içən qılıncının qorxusundan Misir və Şam valisi Sultan Fərəcə pənah apardıqları zaman o həzrət (Teymur) belə bir xə-

[246] Firəng məmləkətləri adı altında Avropa ölkələri nəzərdə tutulur.
[247] Badlic – artilleriya növü olub, böyük və qala dağıdan topdur.
[248] Ə.Nəvai *(Şərhlər, s.138-139)* barıtın Avropada deyil, Çində ixtira edildiyini bildirərək, buradakı məlumatı doğru hesab etməmiş, həmçinin Qara Osmanla Sultan Çəkümün savaşında odlu silahdan istifadə edilməsinə şübhə ilə yanaşmışdır.
[249] Adı Şihabəddin olan bu şəxs həm də Mardin sultanının qardaşı oğlu idi *(Ə.Nəvai, şərhlər, s.140).*
[250] Ruha (Urfa) – Türkiyənin cənub-şərqində yerləşən indiki Şanlıurfa şəhəri.
[251] Yağmur bəy – Qara Osmanın əmisi oğlu idi və Çəkümlə savaşda igidlik göstərmişdi *(Ə.Nəvai, şərhlər, s.140).*

bər göndərmişdi: “Əgər sultan bizim məhəbbətimizə sadiqdirsə, gərək Qara Yusifi qətlə yetirsin və Sultan Əhmədi tutub aləmin pənahı olan dərgahımıza göndərsin”. O fərmana əsasən, onların hər ikisi Dəməşqin bürclərindən birində məhbus edildilər. Qara Yusifin vəfadar mülazimləri cümləsindən olan Pir Ömər səqqalıqla[252] məşğul olub onların dolanışığını təmin edirdi.

Bu əsnada Dəməşq hakiminə məruzə etdilər ki, “Qara Yusifin arvadının yanında bahalı bir ləl[253] vardır”. Bu səbəbdən onu yanına çağırdı. O, məhrəmlərindən birinə dedi ki, “əgər məni işgəncə ilə həlak edərlərsə, saçlarımın arasında gizlətdiyim bu ləli Qara Yusifə təslim edərsiniz”.

“Qadın olan hər kəs namərd deyildir,
Qadın o kişidir ki, dərdsiz olsun.
Bir çox rəna gözəl var ki, erkək aslan kimidir,
Onlar döyüşdə çox aslanın öhdəsindən gələrlər”.

Qara Yusif bu hadisədən agah olduqda dedi:

- Belə əhəmiyyətsiz bir şeydən ötrü özümüzü əziyyətə verməyimiz rəva deyildir. Gərəkdir ki, o ləli onlara təslim edəsiniz. Əgər mən salamat qalsam, onun əvəzini çıxa bilərəm.

Qara Yusifin möhtərəm hərəmi onun buyruğuna əsasən, ləli onlara təslim etdi. O əsnada Qara Yusifin bir oğlu anadan oldu. Sultan Əhməd onu oğulluğa qəbul etdi. Adını Pirbudaq qoydular və bir-biriləri ilə şərt kəsdilər ki, əgər bu bəladan nicat tapsalar, Azərbaycan Qara Yusifin, İraqi-Ərəb isə Sultan Əhmədin olsun. Bir gecə Qara Yusif röya aləmində (yuxuda) gördü ki, onu Sahibqiranın məclisinə aparmışlar. O həzrət öz barmağından üzüyünü çıxarıb Qara Yusifin barmağına taxdı. Səhər bu əhvalatı Sultan Əhmədə danışdı. O da cavabında buyurdu ki, “sən onun bəzi vilayətlərinə sahib olacaqsan”.

O əsnada Dəməşq məlikülümərası Şeyx Xasəgi[254], Sultan Fərəcə qarşı müxaliflik etməyə başladı. O diyarda böyük bir çaxnaşma baş verdi. Ona görə də Sultan Fərəc onları həbsdən çıxarıb ehtiram göstərdi. Misirdə və Şamda olan təqribən min nəfər türkman cavanı Qara Yusifə xidmətkarlıq və mülazimlik kəmərini bellərinə bağladılar. O, hər gün adamları ilə ata minib sultanın dərgahına gəlirdi. Bir gün Sultan Fərəc meydanda çövkən oynamaqla məşğul idi. Qara Yusif də Pir Ömər, Sultan Xoca, Bayəzid, Dəli Musa və Veys Qorçu kimi bir sıra mülazimləri ilə onun yanında çövkən oynamağa başladı. Digər türkmanlar da uzaqdan [onlara] baxırdılar. Onların oyunu Misir əmirlərinin xoşuna gəlmədi və hökm etdilər ki, türkmanlar atdan enib meydanın daşını təmizləsinlər. Qara Yusif fikirləşdi ki, onları tutmaq istəyirlər. O, atını sultanın yanına sürüb ərz etdi:

- Biz [burada] qərib adamlarıq. İndi isə padşahın icazəsi ilə öz diyarımıza gedirik.

Və dərhal meydandan öz mənzilinə gəlib, arvad-uşağını götürərək hərəkət bayrağını Diyarbəkrə doğru qaldırdı. Misir əmirləri onu təqib etmək istəsələr də, sultan mane oldu.

Qara Yusif Misir hüdudundan Fərat sahilinə kimi yolu onların üzünə bağlamış olan sərhəd mühafizəçiləri və qala qoruyucuları ilə yüz səksən yerdə döyüşüb qalib gəldi. Elə ki Mardinə çatdı, oranın sultanı izzət və ikram şərtlərini yerinə yetirib, bir dəqiqə belə xidmətkarlıqdan və fədakarlıqdan əl çəkmədi. Həmin qışda orada qışlaq etdi və baharın əvvəllərində, gecə ilə gündüzün bərabər olduğu vaxtda izdihamlı qoşunlar və adlı-sanlı əmirlərlə, o cümlədən Bitlis[255] hakimi Şəmsəddinlə birlikdə Qara Osman Bayanduru yox edib ortadan qaldırmağa yollandı.

Bu möhnətli xəbər o məşhur əmirə çatdıqda Həsənkeyf[256] hakimi ilə birlikdə onları qarşılamağa çıxdı və Mardinlə Həsənkeyf arasındakı Təqi (Tağı)[257] mövqeyində böyük bir döyüş baş verdi. O əsnada Qara Osmanın oğlu İbrahim bəy bir dəstə igidlə Qara Yusifin sağ cinahını məğlubiyyətə uğratdı. Axırda xeyirxah

[252] Səqqa – hərfi mənası tuluqla su daşıyan, su satan adam, suçu və ya tuluqçu. Həmçinin ordunun su təchizatı və ordu üçün zəruri olan suyun daşınıb gətirilməsi ilə məşğul olan adamlar da “səqqa” adlanırdılar.

[253] Ləl – yaqut növündən olan al qırmızı rəngli qiymətli daş.

[254] Şeyx Xasəgi – h. 804 / m. 1401-ci ildə Şam (Dəməşq) hakimi təyin edilmiş, h. 815 / m. 1412-ci ildə əl-Məlik əl-Müəyyəd adı altında Məmlük sultanı olmuş və h. 824 / m. 1421-ci ildə vəfat etmişdir *(Ə.Nəvai, şərhlər, s.141)*.

[255] Bitlis (Bidlis) – Türkiyədə, Van gölündən cənub-qərb tərəfdə yerləşən bir şəhərdir.

[256] Həsənkeyf (Hısın-keyfa) – Türkiyədə, Diyarbəkrdən şərq tərəfdə yerləşən yaşayış məntəqəsi.

[257] Hal-hazırda Türkiyənin Mardin vilayətinin Savur ilçəsinə bağlı bir kənddir.

adamların sözləri ilə o mücadilə sülhlə əvəzləndi. Daha əvvəl bildirildiyi kimi, Qara Osman Sultan Çəkümə qarşı savaşa getdi.

Qara Yusif isə Ərzincana[258] yola düşdü. O, Kürdüstana, Vana[259] və Vostana[260] basqın edib istila bayrağını ucaltdı və Avnik[261] qalasını Əmir Doldayın əlindən aldı. Qara Yusifin əzəmət və şövkətinin [xəbəri] ardıcıl və mütəmadi surətdə Mirzə Əbu-Bəkrə çatdığı üçün o, həmin zaman Sultan Əhməd Cəlairin üzərinə getmək istəsə də, bu yürüşdən əl çəkib Qara Yusiflə savaşa yollandı.

O tərəfdən Qara Yusif də türkman əmirlərini toplayıb onlara dedi:

- Biz ata-babalarımızın yolu ilə getməliyik. Yayda Aladağ yaylağına gedərik, qışda isə Diyarbəkr qışlağına və Fərat kənarına yürüyərik. Bizim cağatay qoşunları ilə ədavət etməyimiz məsləhət deyildir.

Türkmanlar dedilər:

- Əgər Sahibqiranın Azərbaycanda qoyduğu əmirlər həyatda olsaydılar, biz onlarla vuruşmazdıq. Bir halda ki Mirzə Əbu-Bəkr onları öldürmüşdür və [onların yerinə] bir dəstə əclafı yüksəltmişdir, onlardan qətiyyən qorxumuz yoxdur.

Qara Yusif türkman əmirlərinin sözlərinə sevindi. O, xəyal kimi yüksəyə uçan oxlarının qorxusu ilə qartalları göyün zirvəsində pərən-pərən salan və əjdaha görkəmli nizələrinin heybəti ilə aslanları meşədən qaçmağa məcbur edən,

Nəzm

“Düşmən həmləsi qarşısında kamanını möhkəm tutan,
Düşmənin üstünə cumduqları zaman çevik hərəkət edən,
Ox zərbəsi ilə düşmənin gözündən nuru alan,
Nizənin ucu ilə görməyən gözdən su çıxaran”,

seçkin və təcrübəli ərlərlə, döyüşdə sınaqdan çıxmış igidlərlə hərb meydanına yönəlib Mirzə Əbu-Bəkrin qarşısında səf çəkdi. O əsnada Mirzə Əbu-Bəkr qızmış şir və qorxunc bəbir kimi Qara Yusif Türkmanın ordusuna həmlə etdi. [Lakin] onlar İsgəndər səddi və Xeybər[262] qalası kimi dayanıb öz yerlərindən tərpənmədilər.

Nəzm

“Dəmir dəbilqəli igidlər dayandılar,
İsgəndər səddi kimi o döyüş meydanında.
Düşmənin çoxluğundan qorxuları yox idi,
Özlərinin çoxluğu ilə lovğalanmırdılar”.

O əsnada Qara Yusif Türkman son dərəcə cəsarəti və qorxmazlığı üzündən çevik və cəld bir şəkildə təkbaşına cağatay ordusunun səfinin içinə girdi və Mirzə Əbu-Bəkrin qoşunundan altı piyada onu dövrəyə aldı. Qara Yusif iti və sürətli gedən gözəl atını mahmızlayıb, onların arasından salamatlıqla qurtularaq öz qoşununa qatıldı. Ondan sonra hərb atəşi yüksəldi.

Nəzm

“Savaş atəşi elə yüksəldi ki,
Onun şöləsindən göyün üzü tutuldu”.

Qara Yusif Türkmanın ordusu bacarıqlı ərlərin yardımı ilə səy göstərib, qılınc və xəncər zərbəsi ilə səhranın səthini [qanla] Ceyhun [çayına] çevirdilər. Asimanın pərdəsi və yerin örtüyü qır qaralığını aldıqda, aləmin ərazisi zənci ordusunun (qaranlığın) cövlangahına çevrildikdə, həbəş qoşunu (zülmət) yer kürəsinin arxasından qalxıb göylərə üz tutduqda, mavi səhnə (səma) səyyar ulduzların nurları və çiçəkləri ilə zinət və yaraşıq qazandıqda və firuzə rəngli asiman sabit ulduzların ləlləri ilə gözəllik və bəzək tapdıqda,

Nəzm

“Ulduzlar Cəfəri qızıl kimi mavi günbəzin üstündə,

---

[258] Ərzincan – Türkiyənin şərqində, Ərzurumla Sivas arasında, Fərat çayı sahilində şəhər.
[259] Van – Türkiyənin şərqində, Van gölündən şərqdə yerləşən şəhər.
[260] Vostan (Vəstan) – Türkiyənin Van vilayətinin Gevaş ilçəsində tarixi yer.
[261] Avnik qalası – Ərzurum vilayətinin Köprüköy ilçəsinin Güzelhisar (Avnik) kəndində, Araz çayının cənubunda yerləşir.
[262] Xeybər – Mədinədən Suriyaya gedən yol üstündə yerləşən, güclü istehkamlara malik olan yəhudi şəhəri idi. Bu şəhər m. 628-ci ildə Məhəmməd peyğəmbərin göstərişi ilə Həzrət Əlinin başçılıq etdiyi islam qoşunu tərəfindən fəth edilmişdi.

Müştəri[263] gül dəstəsi kimi, Süha[264] gümüş nöqtə kimi.
Məşriq tərəfdən şəfəq, gümüş tabaq üzərindəki lalə kimi,
Ulduzlar dolaşmaqdadır məşuqəmizin üzündəki tər kimi.
Elə bir qaranlıq gecə ki, cəhənnəmdən nişan verir hər guşə,
Qətrələr tuluqdan töküldüyü kimi ulduzlar düşür səmadan",

hər iki güruh savaşdan yorulub bir-birinin qarşısında yerləşdilər və gecə hər iki tərəf gözətçilik etdi.

Nəzm

"Həmin gecə ki, bu gözəl bağın xurma ağacından,
Tuti uçdu və [yerinə] qarğa oturdu.
Öldürdülər gecəni, çırağı canlı saxlayaraq,
Çıxıb getdi yuxu sevdası beyindən".

Hər iki qoşunun igidləri və hər iki ölkənin dilavərləri iki polad dağ kimi bir-birinin qarşısında dayanmışdılar.

Nəzm

"Dəmirdən hörülmüş iki divar arasında,
Bir küçə təsəvvür et ki, fəna (ölüm) şəhəridir".

Cağatay qoşunları ardıcıl həmlələr edib neçə dəfə türkmanların səflərini pozdular. Qara Yusif, Mirzə Əbu-Bəkri döyüşə çağırıb dedi:

- Bizim ədavətimiz üzündən çoxlu adam tələf oldu. İgidliyin və bahadırlığın şərti odur ki, biz ikimiz [təkbətək] döyüşək.

Nəzm

"Səy göstərək hər ikimiz qılınc və nizə ilə,
Çəkməyək meydan işindən yüyən.
Görək ki, uca asiman (çərxi-fələk),
Kimin boynunu keçirəcək kəməndin ilməsinə".

Mirzə Əbu-Bəkrin ürəyini tamamilə qorxu bürüdü və qətiyyən öz yerindən hərəkət etmədi. Döyüşdən və vuruşdan sonra o iki fitnəkar tayfa öz ordugahlarına qayıtdılar. Mirzə Əbu-Bəkr qərar tutmayıb fərar etdi. Talesizlik tozu yaxşı soylu şahzadənin üzünə qondu və o, həsrət və peşmanlıq suyu ilə əlini mülkdən və maldan yudu. Onun ordusunun əksəriyyəti Araz çayında qərq oldu. Zəfər şüarlı qoşunların əlinə o qədər çox mal düşdü ki, onları təqib etmədilər. Mirzə Əbu-Bəkr özünü məhdud bir dəstə ilə Təbrizə çatdırıb rəiyyətin mallarına əl uzatdı. Şeyx Qəssab səhrada çoxlu tonqal qalamışdı. Mirzə Əbu-Bəkrin adamları elə bildilər ki, Qara Yusifin ordusu gəlib çatmışdır. [Mirzə Əbu-Bəkr] son dərəcə qorxduğundan onun damarlarının məcrasında qan dondu və onu bürümüş ifrat dəhşətdən kəlləsinin böyük oyuğundakı beyni əridi. Sanki Qara Yusif Türkmanın qantökən nizəsinin xəyalını yuxuda görmüş və ya onun iti qılıncının parıltısını yada salmış kimi şəhəri atıb fərar etdi. Qara Yusif Türkman arzusuna yetmiş və kamına çatmış şəkildə Naxçıvana yönəldi.

O zaman Xoca Seydi Məhəmməd Keçəçi[265], Qara Yusifin dərgahına gəldi. Qara Yusif bargahından (çadırından) çıxıb şeyxi ağuşuna basdı və ondan Təbrizin halını soruşdu. Şeyx onu Təbrizə doğru getməyə təhrik etdi. Qara Yusif cavabında dedi:

- Sahibqiran Əmir Teymur Kürəkanın çox sayda övladı qalmışdır. Mən əhd etmişəm ki, onlarla düşmənçilik etməyəcəyəm. Bu savaşın baş verməsinə Mirzə Əbu-Bəkr bais oldu. Mənim səltənətlə işim yoxdur.

Xoca Seydi Məhəmməd gözəl nitqi və ürək oxşayan kəlmələri sayəsində elə etdi ki, Qara Yusif Təbrizin mühafizəsi üçün bir dəstə göndərdi. O səadətli hökmdar Mərənddə qışlaq etdi. O əsnada Əmir Bistam Cagirlü onun dərgahına tələsib əmirülüməralıq[266] mənsəbini əldə etdi.

---

[263] Müştəri – Yupiter planeti.
[264] Süha – Kiçik Ayı bürcündə görünən kiçik bir ulduz.
[265] Təbrizin seyidlərindən və məşhur şəxslərindən idi *(Nəvai, şərhlər, s.146).*
[266] Əmirülüməra - əmirlər əmiri, baş sərkərdə.

### Sultan Əhməd Cəlairin əhvalı və onun İraqı ələ keçirməsi haqqında söhbət

Qara Yusif Türkmanın qaçışından sonra Sultan Əhməd Cəlairin Misirdə etibarı qalmadı. O, dərvişlər kimi çiyninə xirqə atıb, əynində keçə geyərək tam kədərlə Şama[267] yollandı və Diyarbəkr yolu ilə Hilləyə[268] tələsdi. Sərgərdanlar və avaralar o pis xilqətlinin yanına toplaşdılar. Onun gəlişinin avazı İraqi-Ərəbdə yayıldı. Şayiələr Bağdadı elə bürüdü ki, o şəhərin valisi olan Dövlət Xoca İnaq Bağdadı atıb Mirzə Ömərin yanına tələsdi.

Sultan Əhməd gecə vaxtı Bağdada gəlib o şəhəri mühafizə altına aldı. Bir müddət sonra eşitdi ki, Şirvan valisi Şeyx İbrahim çoxlu ordu ilə Təbrizi ələ keçirmişdir. O, türkman və kürd qəbilələrini toplayıb hərəkət bayrağını Təbrizə doğru qaldırdı. Şeyx İbrahim xof və qorxu səbəbindən şəhəri tərk edib Şirvana yola düşdü. Neçə gündən sonra Sultan Əhməd sayı ulduzlar qədər olan qoşunlarla Təbriz dövlətxanasına[269] çatdı. Qazı İmadəddin onun hüzuruna gəldi. Sultan dedi:

- Nə üçün Əlincəq qalasını Mirzə Ömərin sözü ilə viran etdin?

Qazı cavabında buyurdu:

- Düşmənlər Azərbaycan diyarını istila etdiklərindən və ora (Əlincəq qalası) istehkamlı bir mövqe olduğundan oranın onlar (düşmənlər) üçün sığınacağa çevrilməsini istəmədim. İndi ki sultan öz irsi məmləkətinə yiyə durmuşdur, əgər fərman versə, iki gündə oranı təmir edərəm.

Bu söz sultanın xoşuna gəldi. O, qazını[270] qalanın təmirinə göndərdi. Özü isə ürək açan nəğmələr və coşğun tərənnümlər dinləməklə, göyərçinlə oynamaqla və saqqalsızlarla ("əmrədan") söhbət etməklə vaxtını keçirdi. Bu səbəbdən Əli Oyrat və Əmir Əli Ərəb, Mirzə Əbu-Bəkrin yanına məktublar göndərib onu Təbrizə gəlməyə təhrik etdilər və həvəsləndirdilər. Sultan Əhmədin əmri ilə Sultaniyyə qalasını mühasirə etməklə məşğul olan Şeyx Hacı məktubları ələ keçirib sultana göndərdi. Sultan onları həbs edib Bağdada yolladı. Mirzə Əbu-Bəkr bir neçə gündən sonra Təbrizə çatdı. Daha öncə qeyd edildiyi kimi, Qara Yusiflə döyüşdən sonra çıxıb getdi.

### Fars diyarında baş vermiş hadisələr haqqında söhbət

Bu il Mirzə İsgəndər Kirman valisi Əmir İdigünün [vəfatı] xəbərini eşitdikdə, çoxlu qoşun və saysız məiyyət toplayıb hərəkət bayrağını aman məkanı (darülaman) Kirmana doğru qaldırdı. Kuhbənan[271] mövqeyini ələ keçirib öz diyarına tərəf qayıtdı. O əsnada Mirzə Pir Məhəmməd onu tutub Xorasana yolladı. Lakin Təbəsin[272] Çahardəh [adlı yerində] qaçıb özünü İsfahana yetirdi. Mirzə Rüstəm onunla ittifaq halında Şiraza yönəldi. Mirzə Pir Məhəmməd adamlarını göndərdi ki, Bəndi-Əmirdən[273] Maran qalasının ətəyinə qədər çayın keçid yerlərini mühafizə etsinlər. O əsnada Mirzə İsgəndər cövşən geymiş ordu ilə Süleymanın anasının şəhidgahında (Məşhədi-madəri-Süleyman)[274] Təmur Xocanın başçılığı altındakı düşmənləri ilə döyüşüb qalib gəldi. Faruq keçidindən keçib Kənarə qəsəbəsində yerləşdi[275]. Mirzə Pir Məhəmməd şəhərə sığındı. Mirzə Rüstəm qoşun və məiyyətlə Selm darvazasına[276] gəldi. Qırx gündən sonra aran yerlərini qarət edib İsfahana yola düşdü.

### Müxtəlif əhvalatlar

Bu il Mirzə Əbu-Bəkr, Şəhriyar[277] qalasını tutub o diyarın hakimi Əmir Bəyan Quçini qətlə yetirdi.

---

[267] Şam – Suriya.
[268] Hillə – İraqda, Kərbəladan cənub-şərqdə, Fərat çayının solsahil hissəsində, qədim Babil şəhərinin xarabalıqları yaxınlığında yerləşən şəhər.
[269] Dövlətxana – hökumət evi, dövlət sarayı və ya şahın məskunlaşdığı hər hansı bir iqamətgah.
[270] Qazı – dini hüquq əsasında hökm çıxaran şəriət məhkəməsi hakimi.
[271] Kuhbənan – İranın Kirman vilayətinin şimalındadır.
[272] Təbəs – İranda, Məşhədlə Yəzd arasında, Dəşti-Lüt səhrasının şimalında yerləşən şəhər.
[273] Bəndi-Əmir – Şirazın şimal-şərqində kənd.
[274] Təxti-madəri-Süleyman, Qəsri-Əbunəsr adları ilə də məşhur olan bu yer Şiraz şəhərindən 6 km. şərqdə yerləşir.
[275] Faruq və Kənarə – Şirazın şimal-şərqində yerləşən kəndlər.
[276] Selm darvazası – Şiraz şəhərinin cənub-qərbində yerləşir və oranın şeyxlərdən Əbu-Zəkəriyya Selm ibn Abdulla Şirazinin adı ilə bağlıdır. İndi bu darvaza Şah-Dai adı ilə tanınır *(Ə.Nəvai, şərhlər, s.148).*
[277] Şəhriyar qalası – Tehran yaxınlığındadır.

Bu il Məlik İsmayılın oğlu Məlik Salehin və Kərt məlikləri[278] zamanında Qur[279] hökuməti əcdadına və özünə məxsus olmuş Məhəmməd İspəhbəd Qurinin fitnəsini yatırmaq üçün bundan öncə o bölgəyə getmiş Əmir Şeyx Loğman Barlasdan və Əmir Həsən Candardan bir qasid gəlib [bunları] ərz etdi:

- Əmirlər deyirlər ki, düşmənlərin sayı olduqca çoxdur. Ona görə də tədbiri və ehtiyatı əldən buraxmayaraq onların üstünə getmədik. Hər nə əmr etsəniz, ona əməl edəcəyik.

O həzrət (Şahrux) Əmir Seydi Əhməd Tərxanı Əmir Fərman Şeyxlə birlikdə qoşunlarla onların köməyinə yolladı. Əmirlər bir-birinə qoşulub yağının (düşmənin) üzərinə getdilər. Məhəmməd İspəhbəd qaçdı və Məlik Saleh[280] əsir tutuldu. Qalib ordu qeyri-məhdud qənimətlərlə geri döndü. [Şahruxun] buyruğu ilə onu (Məlik Salehi) yasaya (cəzaya) çatdırdılar (öldürdülər).

**Ölümlər**

Mirzə Pir Məhəmməd ibn Mirzə Cahangir ibn Sahibqiran Əmir Teymur Kürəkan – bu il, çaharşənbə günü[281], ramazan [ayının] 14-də (22.02.1407)[282] Pir Əli Taz qəfil bəla kimi Mirzə Pir Məhəmmədin üzərinə hücum çəkib ona bir sıra yaxın adamları ilə birlikdə ölüm şərbəti içirdi. Səltənətinin müddəti üç il olmuşdur. Məmləkəti Qəzneyn[283] və Kabil idi.

Mirzə Ömər ibn Mirzə Miranşah ibn Əmir Teymur Kürəkan, daha öncə qeyd edildiyi kimi, bu il öldürüldü. Səltənətinin müddəti iki il olmuşdur.

**810-CU İLİN (08.06.1407 – 26.05.1408) HADİSƏLƏRİ**

Bu il dosta nəvaziş göstərən, düşməni məhv edən padşah (Şahrux) Mirzə Pir Məhəmmədin intiqamını almaq üçün Pir Əli Tazla savaşmağa getdi. Dukə[284] mənzilini şərəfli qədəmi ilə zinətləndirdiyi vaxt Pir Əli Tazın qaçması haqqında xəbər əlahəzrətin qulağına çatdı. O, Əmir Seyid Əhmədi, Əmir Yadigarşahı, Əmir Nuşirəvanı, Əmir Həsən Sufi Tərxanı, Əmir Çaharşənbəni və Əmir Cahan Məliki Bəhram kimi güclü bahadırla birlikdə həmin nankoru təqib etmək üçün göndərdi. Əmirlər onu məğlub edib yüklərini və mallarını ələ keçirdilər.

Bəlx ətrafı zəfər nişanlı qoşunların çadırlarının qurulduğu yer olduqda əmirlər müzəffər və qalib şəkildə, qeyri-məhdud qənimətlərlə hökmdarın ordusuna qoşuldular. Həzrət Şahrux, Sahibqiranın hakimiyyətinin əvvəllərindən o zamana qədər viran qalan Hindüvan qalasını yenidən təmir etdirdi və o diyarın idarəçiliyini Mirzə Pir Məhəmmədin oğlu Mirzə Qayduya lütf etdi.

O əsnada xəbər çatdı ki, Pir Əli Taz Yekə-Üləngdə[285] oturmuşdur. O həzrət Əmir Mizrabı, Əmir Təvəkkül Barlası və Şeyx Loğman Barlası müqayisəyəgəlməz bir ordu ilə onu dəf etməyə göndərdi. Özü isə nəfis vücudu ilə Herat tərəfə qayıtdı. Əmirlər Pir Əli Tazla döyüşüb qalib gəldilər. O, Hinduquş[286] keçidinə sığındı. Əmirlər Herat tərəfə döndülər.

Bu il Mirzə Pir Məhəmməd çoxlu ordu və sonsuz güruhla hərəkət bayrağını İsfahana doğru qaldırdı. Həmin vaxt Gəndümanda[287] olan Mirzə Rüstəm çaşqınlıqdan “Şiraz karvançıları bizim üçün hədiyyələr gətirirlər” deyərək [onları] qarşılamağa çıxdı. Filan mövqedə[288] iki tərəf səf çəkdi. Mirzə Rüstəm və Qazı Əhməd Said mərkəzdə (“qəlb”də) qərar tutdular. Mirzə İsgəndər sol cinahda yerləşdi. O tərəfdən Mirzə Pir Məhəmməd, Əbu-Səid Barlasla, Şeyx Məhəmməd Cavanla və Sədiqlə birgə mərkəzdə (“qol”da) dayandı. Sağda

278 Kərt məlikləri – XIII-XIV əsrlərdə Heratda hökm sürmüş tacik mənşəli xanədan *(İ.H.Siddiqui. Kert // TDVİA, cilt: 25; yıl: 2002; s.297).*

279 Qur (Quristan) – Əfqanıstanın mərkəzi hissəsində, Hərirud çayı boyunda tarixi vilayət.

280 “Mətləüs-səadeyn”ə görə, Məlik Müsəlləh ibn Məlik İsmayıl *(Ə.Nəvai, şərhlər, s.149).*

281 Fars dilində həftənin günləri bu ardıcıllıqla düzülüb: yekşənbə (bazar), düşənbə (bazar ertəsi), seşənbə (çərşənbə axşamı), çaharşənbə (çərşənbə), pəncşənbə (cümə axşamı), cümə, şənbə.

282 Çaharşənbə (çərşənbə) günü 23 fevrala təsadüf edir.

283 Qəzneyn (Qəznə) – indiki Əfqanıstanda, Kabildən cənub-qərb tərəfdə, Kabil – Qəndəhar avtomobil yolu üzərində şəhər.

284 Bu yer Xoca Əhməd Dukə, Xoca Dukə kimi də qeyd olunur *(Ə.Nəvai, şərhlər, s.150).*

285 Üləng – köhnə türk dilində çəmən deməkdir.

286 Hinduquş – Əfqanıstan və Pakistanda sıra dağlar.

287 Gəndüman – İsfahan şəhərinin cənub-qərbində yaşayış məntəqəsi.

288 Bu yerin adı məlum deyil.

Əmir Çolbanşah Barlası qoydu və Xoca Həsən Sərbəndiyə solu tutmağı tapşırdı. Mirzə Rüstəm bir dəstə səf yaran bahadırla Fars ordusuna[289] həmlə etdi.

Nəzm

“Bir anda şeypur çaldılar,
Ordunun mərkəzinə hücum etdilər.
Döyüşçülər tam həşəmət və güclə,
Bir-birinə cumdular şir və pələng kimi”.

Döyüşdən və vuruşdan sonra İlahi lütfkarlıq yeli Mirzə Pir Məhəmmədin bayrağının pərçiminə əsdi. Mirzə Rüstəm və Mirzə İsgəndər ağır məğlubiyyətə uğrayaraq Xorasan tərəfə fərar etdilər. Mirzə Pir Məhəmməd İsfahan hakimliyini öz oğlu Mirzə Ömərşeyxə verərək Şiraz tərəfə qayıtdı.

**Mirzə Əbu-Bəkrin və Mirzə Miranşahın Qara Yusif Türkmanla müharibə etməsi haqqında söhbət**

Bu il Mirzə Əbu-Bəkr eşitdi ki, Qara Yusif Türkman Azərbaycandan Sultaniyyəyə doğru yola çıxmışdır. O, Dərviş Quşçunu iki yüz süvari ilə Sultaniyyədə qoyub Dəmavəndə[290] yönəldi. Qara Yusif isə bir dəstə bahadırla Sultaniyyəyə gəlib, o şəhərin rəiyyətini köçürərək Azərbaycana göndərdi.

O əsnada Sultan Üveysin[291] qızının oğlu olan Sultan Mötəsim ibn Sultan Zeynalabidin ibn Şah Şüca hüzura gəldi. Qara Yusifin Təbrizə yönəldiyini eşidən Mirzə Əbu-Bəkr Sultaniyyəyə gəlib oradan Ərdəbilə yola düşdü. O bölgəni də qarət edib, Marağanı da talayaraq mallar ələ keçirdikdən sonra Çəmçəmalda[292] qışlaq etdi. Baharın əvvəllərində, gecə-gündüz bərabərliyi zamanı xəbər gəldi ki, Cavni Qurbanın əmirləri Novruz və Əbdürrəhman beş min süvari ilə Səmərqənd tərəfdən çıxıb, Xarəzm yolundan keçərək Astarabada gəlmişlər. [Mirzə Əbu-Bəkr] adamlar göndərib onları yanına çağırdı. Əmirlər Dərcəzin hüdudunda zəfərə yaxın olan orduya qoşuldular. Baba Hacı Gavərud qalasından qeyri-məhdud bir qoşunla müzəffər orduya qatıldı. Mirzə Əbu-Bəkr onların varlığına arxayın olub, cilovunu boşlayaraq köçhaköçlə qiyamət günü kimi Təbrizə yönəldi.

O tərəfdən Qara Yusif Türkman arzusuna yetmiş və kamına çatmış halda tam qələbəliklə zilqədə [ayının] 16-da (13.04.1408) Şənbi-Qazanda yerləşdi və öz ordusunun ətrafında xəndək qazdırdı. O, İraq əmirlərini çağırıb dedi:

- Mən türkman qəbiləsindənəm. Mənim yaylağım Aladağ, qışlağım isə Diyarbəkr və Fərat sahilidir. Səltənət işləri mənlik deyildir. İndi Mirzə Əbu-Bəkr döyüş və vuruş meydanına gəlməkdədir. Onun sizin üzərinizdə çox haqqı var. Əgər onun tərəfinə getsəniz, qətiyyən mənim könlümə ağır gəlməz.

İraq əmirləri hamısı birlikdə başlarını itaətlə yerə qoyub dedilər:

- Biz bu xanədanın düşmənlərini dəf etmək üçün tabeçilik kəmərini canımızın ortasına bağlamışıq və bu dövlətin düşmənlərini iti qılınc zərbəsi ilə məğlub edəcəyik.

Nəzm

“Çalışaq və cəldliklə ata minək,
Hamımız sənin yolunda canımızı fəda edək.
Həyat libasını bədənimizdən çıxarmağımız,
Sənin hökmündən boyun qaçırmaqdan daha yaxşıdır”.

Qara Yusif İraq əmirlərinin sözünün və əməlinin bir-birinə müvafiq olduğunu gördükdə, onların hamısını ənamlar və bəxşişlərlə ümidvar edib hər birini gözəl ikram və bol hədiyyə ilə şərəfləndirdi. Ondan sonra iyirmi min süvari və piyada ilə şahzadəni qarşılamağa çıxdı. Sözügedən ilin zilqədə [ayının] 24-də (21.04.1408) Sərdrudda[293] iki tərəf bir-biri ilə qarşılaşdı. Qara Yusif dağ görkəmli bir ata mindi.

Nəzm

[289] Teymurilərin İranın Fars vilayətindəki qoşunları nəzərdə tutulur.
[290] Dəmavənd – İranın Mazandaran vilayətində dağ.
[291] Cəlairilər sülaləsinin hökmdarı Sultan Üveys nəzərdə tutulur. Onun Dilşad sultan adlı qızı Müzəffərilər sülaləsindən olan Şah Şücanın oğlu Zeynalabidinin həyat yoldaşı idi *(Ə.Nəvai, şərhlər, s.151-152).*
[292] Çəmçəmal – Şimali İraqda, Kərküklə Süleymaniyyə arasındadır.
[293] Sərdrud – Təbrizin qərbində yaşayış məntəqəsi.

“Duruşu pələng, yalı bizon və vücudu dağ kimi,
Siması qartal, şövkəti Ənqa[294] və qanadı tuti kimi.
Döyüş çağı onun iki ayağından çıxan tozdan hava qaralar,
Həmlə günündə səba[295] onun iki əlində gizlənər.
Cilvəyə gəldiyi zaman xoş rəftarlı kəklik kimidir,
Yol gedilən gündə isə hiyləgər ala qarğa kimidir.
Nalının gurultusunu Rumdan Kabilə qədər eşidərsən,
Telinin nişanını Hinddən Şüştərə[296] qədər görərsən”.

O, ordunun sağ və sol cinahlarını Əmir Bistam Cagir, onun qardaşı Mənsur, Məsum, onun oğlu Əxi Fərəc, Hüseyn bəy Səədlü, onun qardaşı Pir Məhəmməd, Pir Ömər, Pirzad bəy, onun qardaşı Yadigarşah, Calıq, Əleykə, Pir Əli Sulduz, Tizək və Cəlaləddin Xəlifə kimi ali mənşəli əmirlərə və aslan ovlayan bahadırlara tapşırıb, dəmiri əridən bir dəstə bahadırla cağatay ordusuna həmlə etdi. [Cağatayların] bir qismini yaraladılar və öldürdülər. Mirzə Əbu-Bəkr belə bir hücumu müşahidə etdikdə bir dəstə igidlə türkman ordusu üzərinə at çapdı.

“Sayı ulduzlar qədər olan qoşunu ilə hərəkətə gəldi,
Onların sayı o qədər idi ki, ondan fələk qorxuya düşdü.
Bir anda düşmənlərinin üzərinə töküldülər,
Yeri-göyü bir-birinə vurdular.
Parlaq, möhkəm və iti qılınclardan,
Bədənə almaz və yaqut oturtdular[297].
Başdan və bədəndən o qədər çox qan axdı ki,
Fələyin Süheyli[298] döndü Yəmən əqiqinə[299]”.

Müzəffər qoşunların hücumunun şiddətindən Tizək fərar etdi. Mirzə Əbu-Bəkr onu təqib edərək qətlə yetirdi və onun başını nizənin ucuna taxaraq geri döndü.

Qara Yusif, Mirzə Əbu-Bəkrin mərkəzə həmlə edəcəyini düşündüyü üçü oradan çıxıb digər bir qoşuna qatıldı və fikirləşdi ki, əgər mərkəzin köməyə ehtiyacı olsa, dərhal oraya yardım edərəm. Bu əsnada Əmir Bistam və digər böyük əmirlər kin qılıncını qından sıyırıb Mirzə Əbu-Bəkrin sol və sağ cinahlarına həmlə etdilər. Cani Qurbaninin adamları o həmlə qarşısında tab gətirməyib məğlubiyyətə uğradılar. Türkman bahadırlarının bir dəstəsi mərkəzə yönəldi. Mərkəzin önündə olan Baba Hacı bəy Gavərudi müdafiə olunmağa və müqavimət göstərməyə başladı. Türkman qoşunları kəsici qılınc və can alan nizə zərbələri ilə Baba Hacı bəyin qoşununun bir dəstəsini zillət torpağı üzərinə sərdilər. Mərkəzdən kimsə köməyə çatmadığı üçün Baba Hacı bəy məğlub olub mərkəzə çəkildi. Əmir Bistam və Bəhram [kimi] intiqamçı olan digər əmirlər qarşılarındakı maneələri aradan qaldıraraq mərkəzin arxasına keçdilər. Ona görə də Mirzə Miranşahın dayandığı yer olan ordunun mərkəzinin tərtibi pozuldu. O əsnada Əmir Musa Dögərin qulamı bilmədən Mirzə Miranşahı qətlə yetirdi.

Mirzə Əbu-Bəkr üç nücumi saatdan sonra Tizəkin ardınca getməkdən qayıdıb üç yüz nəfərlə döyüş meydanına çatdı və öz qoşunundan əsər-əlamət görmədi. O, məyus və pərişan halda qaçanların ardınca yola düşdü. Qorxusunun çoxluğundan külək və şimşək kimi tələsirdi, tez dönən çərxi-fələk kimi yer kürəsinin məsafələrini qət edirdi, havada çaxan ildırım kimi təcili şəkildə keçib gedirdi və bulud kimi dönən fələyə qonşu olurdu.

Qara Yusif buyurdu ki, onu təqib etməsinlər. Türkman qoşunlarının əlinə çoxlu mallar keçdi. Onların arasında min ədəd samur dərisi vardı. Türkmanlar bilmədən onları ucuz qiymətə satdılar. Qara Yusif heç kəsin qənimətlərinə tamah salmadı və Mirzə Miranşaha aid olanları öz hərəmsarayına göndərdi. Mirzə Miran-

[294] Ənqa quşu – klassik Şərq ədəbiyyatına görə, Qaf dağında yaşadığı iddia edilən və insanların gözünə görünməyən əfsanəvi bir quşdur. İsmi olub cismi olmayan, yəni adı olub özü olmayan, tapılmayan şeylərə məcazi mənada “ənqa quşu” deyilir.
[295] Səba küləyi – yüngül və lətif meh.
[296] Şüştər – İranın cənub-qərbində, Əhvaz (Hüveyzə) şəhərindən şimalda, Karun çayının orta axarları kənarında yerləşən şəhər.
[297] Burada qılınc almaza, qan isə yaquta bənzədilmişdir.
[298] Süheyl – səmanın cənub tərəfində olan və Yəməndən daha yaxşı görünən ulduz.
[299] Əqiq – qırmızı rəngli qiymətli daş.

şahı öldürmüş qulamı onun əmri ilə qətlə yetirdilər. Mirzə Miranşahın cəsədini Sürxabda[300] dəfn etdilər. Bir müddət sonra Şəmsəddin Quri dərvişlər qiyafəsində gəlib, Mirzə Miranşahın sümüklərini Mavəraünnəhrə apararaq Keş şəhərində dəfn etdi.

Qara Yusif döyüşdə əsir alınan hər kəsin qida ehtiyacını və yol azuqəsini verib onlara çıxıb getmək üçün icazə verdi. O, fikrində padşah olmağı qərara alıb hərəkət bayrağını Aladağ yaylağına doğru qaldırdı, döyüş meydanında mərdanə işlər görmüş Əmir Bistama böyük ehtiram göstərdi və töhfələrlə, hədiyyələrlə birlikdə yaxşı nitq qabiliyyətinə malik elçilərini Sultan Əhməd Cəlairin yanına göndərdi. Sultan onları çox hörmətlə qarşılayıb Pirbudaq və Qara Yusif üçün padşahlıq ləvazimatı göndərdi. Qara Yusif, Pirbudağı səltənətə yüksəldib, sikkəni və xütbəni onun adı ilə zinətləndirdi. Hökmlərdə belə yazmağı buyurdu: "Pirbudaq xan yarlığdan Əbu-Nəsr Yusif Bahadır sözümüz"[301]. Pirbudaq atasının yanına gəldiyi zaman Qara Yusif ona öz döşəyinin üstündə yer verər və özü ədəblə iki dizi üzərində oturardı.

O qış Qara Yusif Təbriz qışlağına hərəkət etdi. O cənnət nişanlı şəhərin böyükləri və əyanları onu qarşılamaq üçün Sufiyana[302] qədər gəldilər, yaxşı xasiyyətli padşahın hüsn-rəğbəti və iltifatı ilə iftixar və fəxr başlarını göylərin zirvəsinə çatdırdılar və türkman hökmdarının qədəmlərinin uğuru ilə Hülaku xanın taxtgahı üstünlük ayağını dövr edən fələyin bürcləri üzərinə qoydu. Günbəgün onun siyasətinin heybəti daha çox ürəklərə yatdı və onun vilayətinin ərazisi daha da genişləndi.

Nəzm

"Öz cilovunu onun istəyinə tapşırdı tale,
Öz yüyənini onun tədbirinə təhvil verdi qəzavü-qədər.
Nə dünya ona tabe olmaqdan üz çevirdi,
Nə baş ona itaətdən boyun qaqçırdı".

### Dövranın aslanı Qara Yusifin əhvalı haqqında söhbət

Bu il Qara Yusif Türkman, Əmir Bistam Cagirlünü İraqi-Əcəmdə hakimlik etməyə göndərdi. O, Sultaniyyəyə çatdığı vaxt Mirzə Əbu-Bəkr tərəfindən həmin qalanın kutvalı[303] olan Dərviş Quşçu müxaliflik etməyə başladı. Axırda Əmir Bistam oranı ələ keçirib o şəhərin hakimliyini öz qardaşı Məsuma həvalə etdi, həmçinin Qəzvini və Həmədanı da tutdu.

### Əlincəq qalasının fəthi

Bu il Qara Yusif, Busadı qoşunla Gavərud qalasını mühasirə etməyə göndərdi. Baba Hacı o qalanı möhkəmləndirdi. Türkman ordusu lağım, rəadə, mancanaq və s. kimi qala almaq üsullarını bilmədiyinə görə Busad bir dəstə türkmanla xəndəyin kənarında səf çəkdi. Neçə-neçə ox atdılar. Qəzavü-qədərin əlindən bir gün bir ox açılıb Busadın üzünə dəydi və o yaralandı. Həmin yara böyüdü və axırda o yaradan öldü. Ondan sonra Qara Yusif özü qalanın ətəyinə gəldi. Qalanın möhkəm olduğunu görüncə, mühasirədən peşman oldu. Onun fikrincə, bir igid adam yüz qaladan daha yaxşıdır (yüz qala bir igidə dəyməz) və həmişə deyərdi: "Axı aqil adamlar belə bir döyüşə necə razı ola bilərlər ki, o tərəfdən atılan ox ürəyə, bu tərəfdən atılan ox isə gilə dəyir?!"

Bundan başqa, daha öncə qeyd edildiyi kimi, Sultan Əhməd Cəlairin göstərişi ilə Qazı İmadəddin Əlincəq qalasını təmir etməklə məşğul oldu. Qısa müddət ərzində o, oranı əvvəlki halına geri qaytardı. Qala ətrafında yerləşən bəzi bölgələrin kələntərlərini[304] və sərdarlarını köçürüb qalanın içinə apardı. Sultan Əhməd

---

[300] Sürxab dağı – Təbriz yaxınlığındadır.

[301] Bu cümlə orijinal mətndə də türkcə yazılmışdır. "Mətləüs-səadeyn"də bu hadisə h. 814-cü ilə aid edilmiş və həmin cümlə belə yazılmışdır: "Sultan Pirbudaq yarlığından Əbunnəsr Yusif Bahadır sözümüz" *(Ə.Nəvai, şərhlər, s.155).*

[302] Sufiyan – Cənubi Azərbaycanda, Şəbüstər şəhristanında qəsəbə.

[303] Kutval – qalanın rəisi, komendantı.

[304] Kələntər (farsca "böyük" deməkdir) – daruğadan sonra şəhər idarəçiliyində ikinci mühüm vəzifə sayılırdı. Əgər daruğalar şəhərin hərbi-siyasi və inzibati rəisi idilərsə, kələntərlər şəhərin mülki və sosial-iqtisadi həyatına başçılıq edirdilər (daha ətraflı bax: *М.Х.Гейдаров. Социально-экономические отношения, с.81-84,113; З.Г.Байрамов. Местное и городское управление в Азербайджане в системе государства Сефевидов. Автореферат диссертации на соискание ученой степени кандидата исторических наук. Баку, 1985, с.17).*

Təbrizdən Bağdada getdikdən sonra Təbrizdə sanballı bir hakim olmadığından qazı istila bayrağını qaldırdı. Qara Yusif o qalanın heç vəchlə alına bilməyəcəyini başa düşdüyü üçün hökm yazdı ki, qala və oraya yaxın olan neçə-neçə yerlər qazıya verilsin, amma Əlincəq qalasından nisbətən daha uzaqda yerləşən bölgələr öz oğlu İsgəndərə həvalə edilsin. Qazı İmadəddin Naxçıvanın say-seçmə adamlarından idi. Ağıl və fərasətdə tay-tuşlarından üstün və seçkin idi. Onun işləri yaxşı getməyə başladı və bütün Naxçıvan tümənini ona həvalə etdilər. Haraya bir bərat[305] yazsaydı, həvəslə və rəğbətlə vergini təslim edərdilər. Qısa zaman ərzində çoxlu mal topladı. Hər gün qazının adamlarının sayı artırdı. Hakimiyyət qüruru qazının beynində özünə yer tapdığından qardaşlarına dedi:

- Bu ətrafda yurd və məqam tutmuş türklərdən və türkmanlardan [ibarət] tayfanı gərək öz yanımıza gətirək. Çünki taciklərin[306] bacarmadıqları bir çox işləri onlar edə bilərlər.

Əcəlin zərurəti qazını sövq etdi ki, türklərdən və türkmanlardan Veysi, onun qardaşlarını və qohumlarını, Hacı Qorçunu, Cəmaləddini, Şəhriyarı və bu camaatdan olan başqalarını ailələri və köçləri ilə birlikdə qalaya daxil etsin və qalanın bir tərəfini onlara tapşırdı. Onların hamısına ürəklərinin istədiyinə uyğun şəkildə ülufə və maaş təyin etdi.

Bir müddət bu minvalla keçdi. Türklər gördülər ki, qazının vəzir və müşavirlərinin hamısı taciklərdir və onlardan heç kimin mülk və mal işlərinə müdaxilə etməsinə imkan vermirlər. O qövmün könlündə qəzəb və həsəd atəşi alovlandı. Bir-birləri ilə danışıb qərara gəldilər ki, çaharşənbə günü, ilk namaz vaxtı qazının evində toplansınlar və onu ortadan qaldırıb qalanı ələ keçirsinlər. Qərarlaşdırdılar ki, ucadan fəryad edildiyi zaman hər kəs silaha əl atsın. Həmin çaharşənbə gününün səhərində bir şəxs qazıya dedi ki, "türklər toplanmışlar və xəlvətcə öz aralarında danışmışlar". Qazı qardaşlarına buyurdu ki, "gərək sabah türklərin hamısını toplayaq, layiq olanlarını burada saxlayaq, şər və fitnə əhlini isə qaladan çıxaraq". Həmin gün zöhr (günorta) vaxtı qazı yuxuda olarkən türklər onun evinin qapısında toplandılar və ucadan nərə çəkdilər. Qılınclarını çəkib qədəmlərini önə qoydular. Qalmaqal və qovğa yüksəldikdə qazının qardaşı olan igid, cəsur və pəhləvan Tacülislam qılıncını çəkib evdən bayıra atıldı. O vaxt Şəhriyar öz kamanına bir ox qoymuşdu və [həmin oxu] onun sinəsinə elə vurdu ki, oxun ucu onun kürəyindən çıxdı. Qazının digər qardaşı Şahmahmud ox və yayla başqa bir qapıdan ayağını bayıra qoydu. Hacı Qorçu onun işini bir oxla bitirdi. Elə bu zaman qazı yuxudan oyanıb qılıncla düşmənlərinin üstünə getdi. Bir qədər vuruşduqdan sonra onu parça-parça etdilər. Qazı İmadəddinin bütün nökərlərini öldürdülər. Onların mallarını isə öz aralarında bölüşdürdülər. Bir-biriləri ilə məşvərət edib dedilər:

- Əgər biz qalanı zəbt etməklə məşğul olsaq, mümkündür ki, onu əldə saxlamağın öhdəsindən gələ bilməyək. İndi məsləhət odur ki, qalanı Qara Yusifin oğlu İsgəndərə tapşıraq və özümüz onun mülazimi olaq. Buradan onun yurduna qədər altı fərsəxdir. Elə bu gecə onu çağırmaq üçün adam göndərmək lazımdır ki, onu xatircəm edək.

Şəhriyar, Mirzə İsgəndəri çağırmağa getdi. Şəhriyar onun iqamətgahına çatıb halı ərz etdi. İsgəndər yanında olan süvarilər və piyadalarla təcili surətdə hərəkətə gəlib qalaya daxil oldu. O, qala əhlinin əhvalını diqqətlə nəzərdən keçirib onların ruzigarının səhifələri üzərində şücaət əlamətlərini gördü. Həmin sərdarlardan hər birinə bir mənsəb verdi: Hacını özünə qorçu[307] etdi, Şəhruyarı divan əmirliyinə təyin etdi, Veysə isə nədimlik[308] verdi. Əlincəq qalasının fəthi haqqında xəbəri Əmir Yusifə məruzə etdi və o da qalanın idarəsini Mirzə İsgəndərə tapşırdı.

### Müxtəlif əhvalatlar

Həmçinin bu il Sultan Əhməd Cəlair Bağdadın qala divarını təmir etdi və oğlu Əlaüddövlə Səmərqənddə həbsdən xilas olub Bağdada gəldi. Sultan Əhməd Cəlair Hillə hakimliyini ona həvalə etdi. Əlaüddövlənin bir oğlu oldu və adını Şeyx Həsən qoydular.

---

[305] Bərat – vergi ödənilməsi haqqında sənəd.

[306] Tacik – Səfəvi mənbələrində farslar bu cür adlandırılırlar. Lakin bu ad bəzi hallarda (burada olduğu kimi) etnik mənsubiyyət bildirməyib, ümumilikdə oturaq əhaliyə şamil olunurdu. Türkman adı altında isə köçəri və ya yarımköçəri türk-oğuz tayfaları nəzərdə tutulurdu.

[307] Qorçular – türkcə "qorumaq" felindən yaranmışdır. Şahın şəxsi qvardiyasının döyüşçüləri belə adlanırdılar.

[308] Nədim – keçmişdə yüksək rütbəli şəxsləri maraqlı söhbətlər, gülməli sözlər və lətifələrlə əyləndirən adam.

Həmçinin bu il Pir Əli Taz Bəlx hüduduna gəldi. Şahrux padşah onun üzərinə bir dəstə göndərdi. Onlar Pir Əlini məğlub edib Herata qayıtdılar. [Pir Əlinin] vəfasız dostları olan Həzarə[309] sərdarları onu öldürüb kəlləsini Herata göndərdilər.

Bu il Şahrux padşah Astarabada yollandı. O diyara gəlmiş Pirək padşah fərar etdi və o həzrət həmin şəhərin idarəçiliyini Mirzə Uluğ bəyə həvalə edib Herata qayıtdı.

Həmçinin bu il Şahrux padşahın əmirlərinin bir qismi yağı oldu. O həzrət onları tutub qətlə yetirdi.

Bu il Mirzə Əbu-Bəkr daha öncə qeyd edilmiş əhvalatdan və qoşununun məğlubiyyətindən sonra Yəzd yolundan Kirmana yönəldi. O diyarın hakimi Əmir İdigü Barlasın oğlu Sultan Üveys o ali mənşəli şahzadəni qarşılamaq əzmi ilə Kirmandan çıxıb Mirzə Əbu-Bəkri şəhərə gətirdi. Axırda onların ittifaqı nifaqa çevrildi. Kirmanlılar yağı oldular və şahzadənin qəsrini dövrəyə aldılar. Mirzə Əbu-Bəkrin məhəllələrdə yerləşmiş nökərləri ona qoşulmağa fürsət tapmadılar. Əhd-peyman bağlandıqdan sonra Mirzə Əbu-Bəkr böyük bir kədər içində qəsrdən çıxıb Sistana[310] yola düşdü. O zaman Sultan Üveys Kic və Məkrana[311] basqın üçün qoşun göndərdi. Kirman şəhərini ordudan xali görən Mirzə Əbu-Bəkr o şəhərə yönəldi. Sultan Üveys çaş-baş qaldı. Elə həmin gün Kic və Məkrana basqına getmiş aləmi yandıran qoşunlar Kirmana çatdılar. Sultan Üveys Bəmə[312] yönəldi və cəmadiyülaxır ayının 24-də (26.11.1407) Mirzə Əbu-Bəkrin qarşısına çıxdı. Kirman əsgərləri dilavərlərin qorxusundan öz ordugahlarının ətrafını qazıdılar. Bir gecə Mirzə Əbu-Bəkr hücuma keçdi. Lakin bir iş görə bilməyib öz ordugahına qayıtdı. Ertəsi gün ordusunun əksəriyyətini Sultan Üveysin qarşısında saxlayıb özü bir dəstə ilə pusquda durdu. Bu məsələdən xəbərsiz olan Sultan Üveys digər tərəfə meyil etdi. Mirzə Əbu-Bəkr elə zənn etdi ki, o, pusqudan duyuq düşmüşdür. Onun ürəyini tam qorxu bürüdü və iki tərəfin cavanları bir-birinə həmlə etməzdən öncə qaçıb aradan çıxdı. Kirman igidləri nadan şahzadənin əksər mülazimlərini qətlə yetirdilər. Mirzə Əbu-Bəkr Cirüftə[313] getdi. Sultan Üveys öz qardaşı Sultan Hüseyni onu dəf etməyə göndərdi. Mirzə Əbu-Bəkr ona qalib gəldi. Sultan Üveys özü şəxsən oraya getdi. Dava-qırğın əsnasında qəzavü-qədər Mirzə Əbu-Bəkrin səltənət büsatını[314] yığışdırdı və tale (təqdir) katibi onun adına ölüm fərmanı yazdı.

## 811-Cİ İLİN (27.05.1408 – 15.05.1409) HADİSƏLƏRİ[315]

### Xorasan diyarında baş vermiş hadisələr və Şahrux padşahın Sistan tərəfə qoşun çəkməsi haqqında söhbət

Bu il Şahrux padşah məiyyəti və ordusu ilə cəmadiyüləvvəl [ayının] 10-da (01.10.1408) hərəkət bayrağını Heratdan Sistana doğru qaldırdı. Fərah[316] ətrafında cah-calalla dayandı. O diyarın hakimi Şah İsgəndər qalanın möhkəmliyinə, tərəfdarlarının və köməkçilərinin çoxluğuna güvənib qala darvazalarını bağladı. [Lakin] o, bu beytin məzmunundan xəbərsiz idi:

Nəzm

---

[309] Həzarə – Kabillə Herat arasında, Əfqanıstanın mərkəzi dağlıq hissəsində yerləşən tarixi vilayət.

[310] Sistan – Xorasandan cənubda yerləşən tarixi vilayət. Hal-hazırda tarixi Sistan vilayətinin bir hissəsi mərkəzi Zabul (Zabil) olmaqla İranın tərkibinə daxildir, digər hissəsi isə Əfqanıstanın Nimruz əyalətini təşkil edir və mərkəzi Zərənc şəhəridir *(Малик Шах-Хусайн Систани. Хроника воскрешения царей /Тарих-и ихйа ал-мулук/. Перевел с персидского: Л.П.Смирнова. Москва, 2000, предисловие, прим. 1).*

[311] Kic və Məkran vilayəti – Sistan vilayətindən cənuba doğru, Ərəbistan dənizi sahilində yerləşən tarixi vilayət. Əslində vilayətin adı Məkran idi, Kic isə onun paytaxt şəhəri idi. Hal-hazırda tarixi Məkran vilayətinin qərb hissəsi İrana aiddir, Kic şəhəri də daxil olmaqla şərq hissəsi isə Pakistanın tərkibinə daxildir *(Малик Шах-Хусайн Систани. Хроника воскрешения царей, прим. 72).*

[312] Bəm – Kirmandan cənub-şərqdə, Kuhbəndan silsiləsinin cənub yamaclarında yerləşən şəhər.

[313] Cirüft – Kirman vilayətində, Bəmdən cənub-qərbdə yerləşir.

[314] Büsat – hərfi mənada xalça, kilim, döşənək deməkdir. Mağazaların pəncərələrindən malların nümayiş etdirilməsinə və təmtəraqlı, zəngin vəziyyətə də büsat deyirlər. "Əhsənüt-təvarix"in bir sıra yerlərində büsat sözü məcazi mənada işlədilmişdir. Həmçinin mənbələrdə "büsatı öpmək" ifadəsindən istifadə olunur ki, bu da müxtəlif şəxslərin şahın hüzuruna gələrək onun oturduğu xalçanı öpmələrini, yəni ona təzim etmələrini, itaət bildirmələrini göstərmək üçün işlədilmişdir.

[315] Nə Tehran, nə də Ankara çapında "811-ci il hadisələri" adlı başlıq yer almamışdır. Lakin əsərin ümumi strukturu və hadisələrin xronologiyası onu göstərir ki, məhz buradan etibarən h. 812-ci ilə qədər şərh edilən hadisələr h. 811-ci ilə aiddir və onlar "811-ci il hadisələri" sərlövhəsi altında təqdim edilməlidir. Bu fikrimizi Fəsih Xəvafinin "Mücməlüt-təvarix" əsəri də təsdiq edir. Adı çəkilən mənbədə Şahruxun 10 cəmadiyüləvvəl tarixində Sistana yürüşə çıxması 811-ci il hadisələri daxilində verilmişdir *(Фасих Хавафи. Муджмал-и Фасихи / Фасихов свод, с.147).*

[316] Fərah – müasir Əfqanıstanın qərbində, Fərəhrud çayı sahilində yerləşən şəhər.

“Əgər sultan meydandan qaçsa qalaya,
Axırda onu oradan utancla çıxararlar”.

Qalibiyyətli qoşun (çərik) bir həmlədə o məğrur güruhu məğlub edib küçəbəndi ələ keçirdi. Şah İsgəndər qalib qoşunların qorxusundan özünü qalaya salaraq qapını bağladı. Bir neçə gündən sonra aman istəyib qalanı təslim etdi. Ondan sonra cahan padşahı Sistana yola düşdü. O diyarın qalasını ələ keçirdi. Daha sonra isə səadətli hökmdar Hirmənd çayı[317] kənarında dayandı və bəndləri sındırdı. Bunlar Rüstəm[318] zamanında düzəldilmiş üç bənd idi.

### Mavəraünnəhr diyarında baş vermiş hadisələr haqqında söhbət

Bu il Xəlil sultan eşitdi ki, Əmir Xudadad Hüseyni igidlik meydanının bir dəstə igidi ilə Xocənd[319] çayı kənarına gəlib. Ona görə də Əmir Allahdadı və Əmir Arğunşahı üç min süvari ilə o qəddarı dəf etməyə göndərdi. Onlar zəfər nişanlı qoşunla düşmənin qarşısına gəldilər və sultanın yanına adam göndərib yardım istədilər. Ona görə də adlı-sanlı şahzadə yaxşı silahlanmış dörd min süvari ilə tam sürətlə yola çıxıb Şiraz kəndində[320] dayandı.

Xəlil sultanın gəlişindən xəbər tutan Əmir Xudadad qarşısına gəlmiş əmirlərə hücum çəkib, gecə vaxtı Xəlil sultanın üzərinə sürətli yürüş edərək son namaz vaxtı güclü bir qoşunla fəlakətin astanasında olan olan orduya yetişdi. Xəlil sultan can qorxusundan qaçış yolunu tutub Şirazın viranə qalasına girdi. Əmir Xudadad elə həmin gün viranəliyi tutub Xəlil sultanı ələ keçirdi və [bu barədə] fərmanlar və hökmlər yazıb, onlara Xəlil sultanın möhürünü basaraq Turan məmləkətlərinin hər tərəfinə göndərdi.

Ona görə də qalibiyyətli padşah (Şahrux) həmin ayın (zilqədənin) 21-də (07.04.1409) Bəhram kimi qəhredeci ordusu ilə Mavəraünnəhr tərəfə hərəkət etdi. O əsnada Əmir Şeyx Nurəddin güclü bir qoşunla zəfərə yaxın olan orduya yönəldi. Əmir Xudadad zəfərə yoldaş olan bahadırlar dəstəsi ilə onların üstünə töküldüb, onun qoşununu tar-mar edərək Səmərqənd tərəfə geri döndü. Hökmdarın məiyyəti Ceyhundan keçdikdən sonra Xudadad uca mənşəli padşahın qorxusundan Xəlil sultanın [əl-qolunu] bağlayaraq hərəkət bayrağını Türküstana[321] doğru qaldırdı. Şahruxun qədəmləri sayəsində Səmərqənd şəhəri cənnətə bənzər oldu. Əmir Şeyx Nurəddin və Əmir Mübəşşir onun hüzuruna gəldilər və böyük əmirlər silkinə daxil oldular.

### Mirzə Ömərşeyxin oğlu Mirzə Pir Məhəmmədin əhvalı haqqında söhbət

Bu il Mirzə Pir Məhəmməd sayı ulduzlar qədər [çox] olan ordu ilə Şüştərə yönəldi. O diyarın hakimləri Xoca Səid Barlas, Şeyxzadə və Təvəkkül onu qarşılamağa tələsib xidmətkarlıq kəmərini bellərinə bağladılar. Mirzə Pir Məhəmməd Şüştər şəhərindəki Darüləmarədə (əmir iqamətgahında) yerləşdi və Dizfulla[322] Hüveyzənin[323] fəthindən sonra Şiraz tərəfə qayıtdı.

Mirzə Pir Məhəmmədin çıxıb getməsi xəbərini eşidən Sultan Əhməd Cəlair Hüveyzəyə tərəf sürətli yürüş edib qəflətən qalanı dövrəyə aldı. Qala camaatı zəfər şüarlı əsgərlərin qorxusundan fərar yolunu tutdu. Sultan Əhmədin qoşunları onların əksərini qətlə yetirdilər. Pir Hacı Kutval[324] Dizful qalasını qoyub Şüştər tərəfə qaçdı. Səlasil[325] qalasının valisi Əmir Üveys qalada qalmayıb Ramhörmüzə[326] getdi. Çünki Pir Məhəmmədin əmirləri orada idilər. Onlar da Şiraz tərəfə qaçdılar. Sultan Əhməd piyadalardan [ibarət] bir dəstəni qətlə yetirdi, yerdə qalan rəiyyəti Şüştərə köçürdü, qalanı yerlə yeksan etdi, Xuzistan[327] qalalarının idarəçiliyini Maqsud Nizədara tapşırdı və Bağdad tərəfə geri döndü.

---

[317] Hirmənd (Hilmənd) çayı – Əfqanıstanda, Hinduquş dağlarının Baba silsiləsindən başlayıb, Hamun gölünü su ilə təmin edir və İran ərazisində, Zabul şəhəri ətrafında, axarsız Sistan çökəkliyində qurtarır.
[318] “Şahnamə” qəhrəmanı Rüstəm nəzərdə tutulur.
[319] Xocənd – Tacikistanın şimalında, Sırdərya çayı sahilində şəhər. Bəzən Sırdərya çayı “Xocənd çayı” adlanmışdır.
[320] Səmərqənd ətrafında yerləşən bir kənd *(Ə.Nəvai, şərhlər, s.162).*
[321] Türküstan – müasir Qazaxıstanı, Orta Asiyanı, Əfqanıstanın bir hissəsini və Çinin şimal-qərbini əhatə edən tarixi vilayət.
[322] Dizful – İranın qərbində, Xürrəmabadla Əhvaz arasında yerləşir.
[323] Hüveyzə (Əhvaz) – İranın cənub-qərbində, Karun çayının aşağı axarlarında yerləşən və Xuzistan vilayətinin mərkəzi olan şəhər.
[324] Bəzi qaynaqlarda “Pir Hacı Kükəltaş” yazılmışdır *(Ə.Nəvai, şərhlər, s.163).*
[325] Səlasil – İranın Şüştər şəhəri yaxınlığında tarixi qala.
[326] Ramhörmüz – Xuzistan vilayətində, Əhvaz şəhərindən şərqdə yerləşən şəhər.
[327] Xuzistan – İranın cənub-qərbində yerləşən vilayət.

Sultan Əhməd Xuzistanda olduğu zaman oğlu Bağdaddan icazəsiz olaraq Azərbaycana yollandı. Qara Yusif Türkman mülazimlərindən bir dəstəsini göndərdi ki, Əlaüddövləni Bağdad diyarının sərhədinə çatdırsınlar. Xoy[328] hüdudunda kürdlər onu tutub Məlik İzzəddinin[329] yanına apardılar. İki aydan sonra Qara Yusif, Məlikə belə yazdı: "Əlaüddövlə, Sultan Əhmədin hökmü olmadan bu sərhədə gəlmişdi. Ona görə də ona üz göstərmədim. Sən də onu Bağdada göndər!". Bu səbəbdən Məlik İzzəddin şahzadəyə rüxsət verdi. Əlaüddövlə Ərdəbil tərəfə yönəldi ki, Şeyx Şərəfəddin Əli Səfəvi ilə söhbətdə vaxt keçirsin. Təbriz nahiyəsinə çatdığı vaxt türkman camaatı onu tutub Qara Yusifin hüzuruna göndərdi. Onun fərmanı ilə Adilcevaz[330] qalasında məhbus edildi.

Mirzə Rüstəmlə Mirzə İsgəndərin Pir Məhəmməd qarşısında məğlubiyyətə uğradıqları zaman Mirzə Rüstəm, Şahrux padşaha pənah aparıb Sistan bölgəsində zəfər nişanlı orduya qoşuldu. Mirzə İsgəndər Əndixuda getdi. O diyarın hakimi Seyid Əhməd Tərxan onu münasib bir məkanda yerbəyer edib onun haqqında Herata xəbər çatdırdı. Cənab Şahrux dağ boyda mərhəməti üzündən fərman yazdı ki, Seyid Əhməd Tərxan ona mane olmasın və istədiyi yerə getməsinə imkan versin. Mirzə İsgəndər qardaşından şəfqət görmək ümidi ilə Şiraza yollandı və Tanrının lütfü ilə şam namazı vaxtı, ramazan [ayının] 26-da (12.02.1409) Səadət darvazasından Şiraza daxil olub Hacı Hüseyn Təbibin evinə getdi. İftar vaxtı Mirzə Pir Məhəmmədə xəbər çatdı. Yeməkdən əl çəkib onu çağırdı və ona növbənöv iltifatlar göstərdi. Onun üçün padşahlıq ləvazimatı və yaraq-yasağı tərtib etdirərək Murdəstan məhəlləsində, Ramazan ağa Axtaçının[331] evində ona yer verdi.

### Müxtəlif əhvalatlar

Bu il Xətay[332] padşahının elçiləri Sahibqiran Əmir Teymur Kürəkan üçün başsağlığı vermək məqsədi ilə bol peşkəşlə Herata gəldilər və öz padşahlarının sözünü Şahrux padşaha ərz etdilər. O həzrət onlara tam ehtiram göstərib, geri qayıtmaları üçün izin verdi.

## 812-Cİ İLDƏ (16.05.1409 – 05.05.1410) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il yeddi ölkənin padşahı (Şahrux) bəla saçan ordusu ilə bədbəxt Xudadadın ardınca Moğolustan (Monqolustan) tərəfə hərəkətə gələrək Mirzə Rüstəmi, Əmir Seyid Əli Tərxanı, Əmir Şahməliki və Əmir Nuşirəvanı bir dəstə igidlə mənqəlay kimi yola saldı. Uratəpə[333] yaylağı fələk şövkətli ordunun dayanacaq yeri olduqda Əmir Şeyx Nurəddin cahan padşahının fərmanı ilə Xudadadı istəmək üçün Moğolustana yollandı. O əsnada qeyb karxanasından elə bir surət üz verdi ki, onun misli heç kəsin xəyal aynasında təsəvvür edilmirdi.

Onun şərhi belədir ki, Xudadad Moğolustan padşahı Məhəmməd xandan yardım istədi. O, bu işi öz qardaşı Şəmi-Cahana tapşırdı. O isə özünün ən yaxın adamlarına dedi:

- Xudadad Hüseyni haqtanımaz və vəfasız bir adamdır. O, Sahibqiran sultanın öz üzərindəki haqqını unudaraq onun övladına qarşı müxaliflik və üsyankarlıq edir.

Sonra isə dərhal onun şərlə dolu başını bədənindən ayırıb Əmir Şahməlikin yanına göndərdi və o cənab yüyənini döndərib ali orduya qayıtdı. Səadətli hökmdar Özcənd[334] bölgəsinin hakimliyini Mirzə Ömərşeyxin oğlu Mirək Əhmədə həvalə etdi və Əmir Şeyx Nurəddin rüxsət alıb Otrar[335] tərəfə getdi.

Xudadadın qətlindən sonra Xəlil sultan onun müvəkkillərini öz tərəfinə çəkib həmin qalada (Əlankuh qalasında) möhkəmləndi. Əmir Şahməlik cahan şahının fərmanı ilə o qalanı mühasirəyə aldı. Xəlil sultan

---

[328] Xoy – Cənubi Azərbaycanda, Urmiya gölündən şimal-qərbə tərəf yerləşən şəhər.

[329] Məlik İzzəddin – kürd rəislərindən idi.

[330] Adilcevaz – Türkiyənin şərq hissəsində, Van gölünün şimal sahilində şəhər.

[331] Axtaçı – yəni miraxur. Ramazan ağa, Müzəffərilər sülaləsindən Şah Şücanın miraxuru olmuşdur *(Ə.Nəvai, şərhlər, s.165).*

[332] Xətay – Şərqi Türküstan. İndi Çin Xalq Respublikasının şimal-qərb ərazisini təşkil edir. Orta əsr mənbələrində bəzən bütövlükdə Çin "Xətay" adlandırılır. Rusca "Kitay" sözü də buradan yaranmışdır. "Əhsənüt-təvarix"də "Xətay padşahı" adı altında Çin hökmdarı nəzərdə tutulur.

[333] Uratəpə (Uratübe) – Tacikistanın şimalında, Xocənd şəhərindən cənub-qərbdə yerləşir.

[334] Özcənd və ya Özkənd – Fərqanə nahiyəsinin şərq qurtaracağında, çox münbit bir ərazidə yerləşirən şəhər *(Nəvai, şərhlər, s.166).*

[335] Otrar – Orta Asiyada tarixi şəhər olmuşdur və xarabalıqları müasir Qazaxıstan Respublikasının Timur dəmir yolu stansiyasından 7 km. şimal-şərqdə, Sırdərya çayının orta axarında yerləşir.

əhd-peyman bağladıqdan sonra cahan padşahının hüzuruna gəlib növbənöv şahanə mərhəmətlə şərəfləndirildi. O həzrət Mavəraünnəhr və Türküstan vilayətinin idarəçiliyini hörmətli və səadətli oğlu Mirzə Uluğ bəyə verdi, Hisrari-Şadman[336] hakimliyini Mirzə Məhəmməd Cahangirə[337], Qəndəhar[338], Kabil və Qəzneyn hakimliyini Mirzə Qaydu ibn Mirzə Pir Məhəmməd ibn Cahangirə lütf etdi və şaban [ayının] 11-də (19.12.1409) gəlişinin kölgəsini Herat şəhərinin üzərinə saldı.

**Mirzə Ömərşeyxin oğlu Mirzə Pir Məhəmmədin öldürülməsi haqqında söhbət**

Bu il Mirzə Pir Məhəmməd Kirmana gedərkən, Düçahə[339] mövqeyində onun təbiblik mərtəbəsindən əmirlik dərəcəsinə çatdırdığı çirkin Hüseyn Şərbətdar bir dəstə qorxusuz adamla Mirzə Pir Məhəmmədin üzərinə tökülüb onu qətlə yetirdi. Mirzə İsgəndər həmin zaman can qorxusundan Şiraza yollandı və iki gündən sonra uğur və bəxtiyarlıqla Səadət darvazasından keçib, Əmir Teymur Xocanın evinə gedərək hadisəni ona danışdı. Şəhərdə olan əmirlər bu hərəkətin səbəbkarının Mirzə İsgəndər olduğunu güman etdilər. Lakin həqiqəti öyrəndikdən sonra onu səltənətə oturtdular. Hüseyn Şərbətdar öz qardaşı Xoca Əlini Mirzə İsgəndəri öldürməyə göndərdi. [Məlum oldu ki], o, Şiraz tərəfə getmişdir. Hüseyn Şərbətdar bir dəstə yaramazla Şirazın ətrafına gəldi. Səhərdən axşama qədər şəhərlilərə müqavimət edib Murdəstan məhəlləsində bazar nəzarətçisi Əlaəddin Məhəmməddən pərişanedici sözlər eşitdi. Şam namazı vaxtı əmirlər o natamamdan üz çevirdilər. Ertəsi gün o qəddar fərar yolunu tutdu. Fərar əsnasında Əmir Sədiqin əlinə düşdü. Onu böyük bir rüsvayçılıqla bir öküzün üzərinə mindirib Şiraza gətirdilər. Mirzə İsgəndər ondan soruşdu ki, "qardaşımı niyə öldürdün?". Cavab verdi ki, "onu öldürməyim sənin üçün pis olmadı". Mirzə İsgəndər öz əli ilə onun sağ gözünü hədəqəsindən çıxardı və onun göstərişi ilə o nifaq əhlinin başçısını çomaq zərbəsi ilə həlak edərək başını İsfahana göndərdilər.

**İraq diyarında baş vermiş hadisələr haqqında söhbət**

Bu il Qara Yusif Türkman, Sultan Mötəsim ibn Sultan Zeynəddini Qazı Əhməd Saidi və Əmir Bistamla bərabər tam qələbəlik bir qoşunla İraq və Fars şəhərlərini almağa göndərdi. Mirzə Pir Məhəmmədin oğlu Mirzə Ömərşeyx, Əmir Səid Barlas, Əmir Çolbanşah və digərləri ordu ilə döyüşmək və vuruşmaq üçün İsfahandan onları qarşılamağa çıxdılar. Lakin döyüşmədən Yəzd tərəfə yüyən çevirdilər. Mirzə Ömərşeyx əmirlərdən ayrılıb Köşki-zərdə[340] Mirzə İsgəndərə qoşuldu. O iki xoşbəxt bir-biri ilə ittifaqda [düşmənlərini] qarşılamağa tələsdilər. Atəşgah[341] ətrafında iki ordu qarşılaşdı. Hər iki tərəf qılınclara və nizələrə əl atdı.

Nəzm

"Götürdülər parlaq qılıncı ələ,
Qol açdılar sərxoş şirlər kimi.
Hiddətlə atlarını çapdılar,
Bir anda bir-birilərinə cumdular".

Dava-dalaş əsnasında Şiraz əyanları ordunun səfini viran qoyub Sultan Mötəsimin qoşununa birləşdilər. Ona görə də onlar cəsarətlənib hamısı birdən həmlə etdilər. Mərkəzə yaxınlaşdılar. Mirzə İsgəndər erkək aslan (şiri-nər) kimi onların üzərinə atıldı. Sultan Mötəsim ona tab gətirməyib qaçmağa üz qoydu. Mirzə İsgəndərin igidləri qılınc və xəncər zərbəsi ilə Məhəmməd Müzəffərin xanədanından tüstü çıxardılar[342]. Azərbaycanın və İraqın əksər əmirləri əsir alındılar, bəziləri isə həlak torpağı üzərinə düşdülər.

---

[336] Hisari-Şadman – müasir Tacikistan Respublikası ərazisində, Kafirnihan çayının yuxarı axarları yaxınlığında şəhər. Bəzən sadəcə olaraq Hisar adlanırdı.

[337] Məhəmməd Cahangir – Əmir Teymurun oğlu Mirzə Məhəmməd sultanın oğludur *(Nəvai, şərhlər, s.167).*

[338] Qəndəhar – müasir Əfqanıstanın cənubunda, Ərqəndab çayının sol sahilində yerləşən şəhərdir və orta əsrlərdə İrandan Hindistana gedən ticarət yolu üzərindəki mühüm bir məntəqə idi.

[339] Düçahə (Düçahi) – Kirmandan qərbdə, Sircan şəhərindən şimaldadır.

[340] Köşki-zər (Qızıl köşk), Qəsri-zər (Qızıl qəsr) və ya Köşki-zərd (Sarı köşk), Qəsri-zərd (Sarı qəsr) – Şirazın 24 fərsəx şimalında kənd *(Nəvai, şərhlər, s.628).*

[341] Atəşgah – Nəcəfabaddan İsfahana gedən yolun üzərində yerləşir. Burada alçaq bir dağın təpəsində hələ də atəşgah qalıqları görülməkdədir *(Nəvai, şərhlər, s.169).*

[342] Məhəmməd Müzəffər – XIV əsrdə Cənubi və Qərbi İranda hökm sürən Müzəffərilər xanədanının banisidir. Sultan Mötəsim onun sülaləsindən idi.

Nəzm

“Baş və bədən bir-birindən ayrılmış qılıncla,
O meydanda düşürülmüş baş amansızlıqla.
Bütün qılınclar qərq olmuş qırmızı qana,
Su dənizindən atəş tökülmüş”.

Sultan Mötəsim məiyyət və qoşunla İsfahan tərəfə qaçdı. İstədi ki, atını arxdan atlatsın. Cüssəsi böyük olduğundan arxası üstə yıxıldı və bir bahadır başını bədənindən ayırdı. Onun fitnə atəşi söndü. Əmir Bistam böyük bir kədərlə Rey tərəfə fərar etdi. Qazı Əhməd Saidi təəssüb boyunduruğunu boynuna salıb, ortabab və yoxsul rəiyyətlə birlikdə öz dar düşüncəsinə əsaslanan böyük iddiaları qarşısına məqsəd qoydu. Hərçənd Mirzə İsgəndər o nadan cahilin yanına yaxşı nitq qabiliyyətinə malik adamlar göndərib onu itaət və tabeçiliyə dəvət etsə də, faydası olmadı. Bu səbəbdən Mirzə İsgəndər həmin yay ta payızın ortasına kimi şəhərin ətrafında oturdu.

Bu əsnada Şahrux padşahın fərmanı ilə Mirzə Rüstəm məiyyət və ordu ilə İsfahana gəlib çatdı. Ona görə də Mirzə İsgəndər İsfahan ətrafından köç edib Yəzdi tutduqdan sonra Şiraza yola düşdü.

## Sultan Əhməd Cəlairin əhvalı haqqında söhbət

Bu il Sultan Əhməd Cəlairin zatının cövhərinə xəstəlik mübtəla oldu. Təbiblərin məsləhəti ilə o, Bağdaddan çıxıb hərəkət bayrağını Üveys-Qərn yaylağına doğru qaldırdı. Orada onun xəstəliyi sağaldı. Eşitdi ki, Bistam Cagirlü İsfahana getmişdir. Fürsəti qənimət bilib, Xurşah Dərcüzini ilə birlikdə Həmədandan keçərək Sultaniyyə çəmənində dayandı.

Bu əsnada xəbər gəldi ki, Veys adlı birisi sultanın oğlu olduğunu iddia edərək səltənət iddiası edir. Ona görə də [Sultan Əhməd] tam sürətlə Bağdad tərəfə yürüş edib, fitnənin xəmir mayası olan bir dəstə adamı tutaraq məhbus etdi.

## Qara Yusif Türkmanla Qara Osman Türkmanın müharibə etməsi haqqında söhbət

Qara Yusif Türkman bu il Məhəmməd Dəvati, Əmir Seyid Əhməd və Uzun Şəmsəddinlə birlikdə zəfərə yaxın olan ordu ilə Muş[343] ətrafına gəlib özünün bargah çadırını günəşin və ayın zirvəsinə ucaltdı.

Nəzm

“O qədər çadır başını Sürəyyaya[344] qaldırdı ki,
Min asiman yer üzündə oldu peyda”.

O əsnada Mardin valisi Məlik Salehin qasidi dərgaha yetişib məruzə etdi ki, “Qara Osman Bayandur bir dəstə inadkar süvari ilə Mardinə gəlməkdədir”. Qara Yusif dəniz kimi coşan və şimşək kimi gurlayan bir ordu ilə Muş səhrasından Adilcevaza yönəldi. O tərəfdən də Qara Osman igidlərdən [ibarət] bir güruhla Qara Yusifin önündə səf çəkdi. Hər iki tərəf zurna çaldı, şeypur və nağara səsləndirdi.

Nəzm

“Səsləndirdilər iki tərəfdən rəvan bir tərzdə,
Sərvərlərin ordusu şeypur və nağara.
İki tərəf bir-birinə hücum çəkdi,
Qülzüm dənizi[345] kimi cuşa gəldilər”.

Şiddətli döyüşdən və vuruşdan sonra Qara Osman qaçış yolunu tutdu. Qara Yusif isə müzəffər ordusu ilə Mardinə yollandı. O diyarın sultanı şəhəri təslim etdi və onun tərəfdarlarının zümrəsinə daxil oldu. Əmir Qara Yusif öz qızlarından birini ona nikahladı, onu mallarla təchiz etdi və onu Mosul[346] əyalətinə göndərərək, o diyarı iqta[347] şəklində ona verib yola saldı. Orada Əmir Qara Yusifin bəzi nökərləri insafsızlıq

[343] Muş (Muşabad) – Türkiyənin şərqində, Xınısdan cənubda və Əxlatdan qərbdə yerləşən şəhər.
[344] Sürəyya – Üklər və ya Yeddiqardaş ulduzu.
[345] Qülzüm dənizi – orta əsrlərdə müsəlman coğrafiyaçılarının Qırmızı dənizə, bəzi hallarda isə Xəzər dənizinə verdikləri ad.
[346] Mosul – indiki İraqın şimalında, Dəclə çayı sahilində şəhər.
[347] İqta (ərəbcə torpaq payı anlamındadır) – orta əsrlərdə müsəlman ölkələrində feodallara verilmiş şərti torpaq mülkiyyəti (daha ətraflı bax: *Z.M.Bünyadov. Azərbaycan VII-IX əsrlərdə, s.127-130*).

edərək onu öldürücü zəhərlə həlak etdilər[348]. Adı çəkilən əmir (Qara Yusif) Mardinin ələ keçirilməsindən sonra Bayburdu[349], Tərcanı[350] və İspiri Ərzincana əlavə edib (Ərzincan əyalətinə birləşdirib) o diyarın idarəçiliyini Pir Ömərə verdi ki, daha rahat, güclü və müstəqil şəkildə Osman bəyə qarşı müqavimət göstərə və müdafiə oluna bilsin və o vilayəti onun iti qılıncının zərərindən qoruya bilsin. Həmin yayda Aladağda yaylayıb, xəzan (payız) fəslində zəfər nişanlı əsgərləri ilə Azərbaycan tərəfə qayıtdı.

Nəzm

"O nahiyə fitnədən xilas oldu,
Aləm bundan rahatlıq tapdı.
Ona görə də yenə uğurlu şahin,
Təbrizə getmək üçün qanad açdı".

O, igidlərin bir dəstəsini Şəki və Şirvana basqın etməyə yolladı. Məlik İzzəddin Şir, Əmir Qara Yusifin yanına gəldikdə Qara Yusif Şirvan üzərinə ordu göndərməkdən daşındı.

Bu əsnada Sultan Əhməd Cəlair elçi göndərib xahiş etdi ki, Həmədan çəməni ona yaylaq olaraq verilsin. Lakin Sultan Əlaüddövlənin həbsi barədə qətiyyən bir şey demədi. Ona görə də Qara Yusif həmin sözlərə iltifat göstərməyib elçiyə izin verdi (elçini geri göndərdi) və o il Təbrizdə qışlaq etdi.

## Müxtəlif əhvalatlar

Bu il Xarəzm padşahı Əmir Edigenin elçisi Herata gəldi və Mavəraünnəhrin fəthini təbrik etdi. O, hüsn-rəğbətlə qarşılandı və öz diyarına qayıtdı. Eləcə də Fulad xanın mülazimləri Dəşti-Qıpçaqdan[351] elçilik qaydasında gələrək şahindən və ov heyvanlarından ibarət çoxlu peşkəş gətirdilər. Şahrux padşah onlara xeyli nəvaziş göstərib yola saldı.

Həmçinin bu il Şahrux padşah, Çingiz xanın oğlu Tuluy xanın [törətdiyi] qətliamdan bu ilə qədər viran qalmış Mərv[352] şəhərini abadlaşdırdı.

## Ölümlər

Xəlil sultan ibn Mirzə Miranşah ibn Sahibqiran Əmir Teymur Kürəkan bu il Rey hüdudunda dünyadan köçdü. Səltənətinin müddəti dörd il olmuşdur. Məmləkəti Mavəraünnəhr idi.

Sultan Xəlilin səltənətinin zavala uğramasının səbəbi o oldu ki, şahzadə Şadmələk adlı alçaq bir qadına vurulmuş, Sahibqiranın zamanında gizli şəkildə onu özünə nikahlamışdı. Amma qorxa-qorxa onunla görüşürdü. Səltənət taxtına əyləşdikdən sonra isə mülk işlərinin yüyənini Şadmələkin iqtidarının əlinə təslim etdi, onun təhriki ilə Əmir Teymur xatunlarından bəzilərini zorla etibarsız (dəyərsiz) adamlarla evləndirdi və malların xərclənməsində israfçılıq edib, Sahibqiran Əmir Teymur Kürəkanın illərlə yığdığı xəzinələri rəzil adamlara bağışladı. Çubuq zərbəsi ilə məzlumların könlünü qıraraq topladıqları malları elə adamlara sərf etdi ki, etibar meyarında onların heç bir çəkisi və dəyəri yox idi. Ona görə də əmirlər və dövlət ərkanı ona nifrət etdi. Daha öncə qeyd edildiyi kimi, axırda öz mülazimi tərəfindən dustaq edildi[353].

Sultan Əli ibn Pir padşah ibn Loğman padşah[354] ibn Toğa Teymur xan bu il Mirzə Uluğ bəyin mülazimləri ilə döyüşdə öldürüldü.

---

[348] Burada haqqında bəhs edilən "Mardin sultanı", Mardin Artuklu bəyliyinin son hökmdarı Şihabəddin Əhməddir (bax: *C.Alptekin. Artuklular // TDVİA, cilt: 3, yıl: 1991, s.417*).

[349] Bayburd – indiki Türkiyənin şərqində, Ərzurumla Trabzon arasında, Çorox çayı sahilində yerləşən şəhər.

[350] Tərcan – Türkiyənin şərqində, Ərzurum və Ərzincan şəhərləri arasında, Fərat çayının yuxarı axarları ilə Qarasu çayı arasında yerləşən bir yer adıdır.

[351] Dəşti-Qıpçaq – orta əsrlərdə Dunay çayının mənsəbindən və Qara dənizin şimal sahillərindən başlamış, İrtış çayına və Balxaş gölünə qədər uzanan və cənubda Xarəzm vilayəti və Sırdəryanın aşağı axarları ilə həmsərhəd olan tarixi vilayət.

[352] Mərvi-Şahican (Mərv) – müasir Türkmənistan Respublikasının cənub-şərqində, Bayraməli və Marı (Mərv) şəhərləri yaxınlığında tarixi şəhər-qala.

[353] Əmirlər şahzadə Xəlili qızıl zəncirlə bağlamış və Şadmələkin qulağını və burnunu kəsmişdilər. Mirzə Xəlil sultanın vəfatı 16 rəcəb 814 / 3 noyabr 1411-ci ildə baş verdiyi yaxşı məlum olduğu üçün həmin hadisəni h. 812-ci ilə aid etmək yanlışdır *(Nəvai, şərhlər, s.173).*

[354] Loğman padşahın adı son Tehran nəşrində yer almamışdır və Ankara nəşrinə əsasən əlavə edilmişdir.

## 813-CÜ İLDƏ (06.05.1410 – 24.04.1411) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Havanın soyuqluğu və qışın şiddəti geri çəkilməyə üz qoydu və səba yelinin əsməsi ilə çəmən təzə-tər və şad-xürrəm oldu.

Nəzm

“Səba yaşıllıqla bəzədi dünya bağını,
Cənnətin bağının bir nümunəsinə çevrildi cahan.
Bağda əsən yel ecazkarlıqla canlandırdı torpağı,
Su İsanın[355] bütün möcüzələrini [yuyub] apardı”.

Belə bir vaxtda Qara Yusif Türkman çoxlu qoşunlarla Ərzincana yönəldi və öz oğlu Şah Məhəmmədi Azərbaycanı mühafizə etmək üçün Ucanda qoydu. Ərzincanın ətrafı türkman hökmdarının gəlişi səbəbindən cənnət bağçasına həsəd bəxş etdikdə o diyarın hakimi Təhərtən oğlu Şeyx Həsən şəhərə sığındı. Türkman ordusu müharibəyə başladı. Qırx gündən sonra Şeyx Həsən Ərzincanın əyan-əşrəfi ilə bol peşkəşlər götürüb türkman hökmdarının dərgahına gəldi və darvazaların, dəfinələrin açarlarını onun vəkillərinə təslim etdi. Qara Yusif o diyarın hakimliyini Pir Ömərə lütf etdi.

Qara Yusifin [Azərbaycanda] olmadığı zaman Sultan Əhməd Cəlair oyrat türkmanları, Kürdüstan və Luristan[356] əşirətləri ilə ittifaq halında Bağdaddan Həmədana gəldi və oradan qantökən ordusu ilə Təbrizə yola düşdü. Müharibə və mücadilə etməyə taqəti olmayan Şah Məhəmməd Xoy tərəfə qaçdı. Sultan Əhməd qoca dünyanın əvvəlki qərinələrdə və keçmiş zəmanələrdə bənzərini müşahidə etmədiyi tam bir qələbəliklə və həddən, gümandan artıq bir dəbdəbə ilə gəldi. Təqribən yüz dəvəlik qatar onun alaçıqlarını, saray pərdələrini, bargah çadırını, digər yüklərini və əşyalarını çəkirdi. Dəvələrinin, atlarının və qatırlarının çoxunun çulları Rumun naxışlı ipək qumaşından və Şam atlasından idi. Onun önündə yedək kimi doqquz at[357] aparırdılar ki, hamısının qızıl yəhərləri və daş-qaşlı yüyənləri vardı. Başının üstündə daş-qaşla bəzədilmiş çətir tutmuşdular. Qırmızı qızıldan düzəldilmiş bir quş heykəlini çətirin başına vurmuşdular və quşun ağzına bahalı bir inci qoymuşdular. Onun əmirləri və əyanları hamısı piyada gedirdilər. Onun ardınca yaraşıqlı cavanlar, hüsn-camal sahibləri və qorçular hər biri zərbafta paltar geymiş və əlində bir növ silah tutmuş halda gəlirdilər. Onun sağ tərəfində məmləkətin ixtiyar sahibi olan Şahin ağa addımlayırdı, sol tərəfində də Bağdad ağa piyada gedirdi. Sultanın qarşısında və arxasında bir ox atışı qədər məsafədə heç bir süvari və piyada yox idi. Hər neçə addımdan bir onun başına qırmızı qızıl və gümüş səpirdilər. Onun tacında bir ləl vardı ki, mütəxəssislər belə onu qiymətləndirməyə aciz idilər. O, belə bir əzəmət və şövkətlə Təbriz dövlətxanasına gəldi. Şah Məhəmmədi təqib etmək üçün getmiş bir sıra əmirlər Xoy ətrafında ona çatdılar. Çox döyüşdükdən sonra hər iki dəstə müharibədən əl çəkib, getmək istədikləri tərəfə yönəldilər.

Elə ki bu möhnətli xəbər Ərzincanda Qara Yusif Türkmana çatdı, dövlət ərkanını toplayıb sülh və hərb barəsində məşvərət etdi və dedi:

Nəzm

“Ey Rüstəmə[358] bənzər aslan igidlər!
Döyüşdən əndişə etməyin siz.
Tanrının lütfü bizə yar olduğu üçün,
Biz düşmən üzərində zəfər qazanacağıq.
Səy göstərmək bizdən, yardım Allahdan,
Nə üçün ayağımızı döyüşdən geri çəkək?!”

Əmirlər də cavabında dedilər:

Nəzm

“Ey cah-calal səmasının günəşi!
Ütarid[359] səninlə müqayisədə bir hilal kimidir.

---

[355] İsa peyğəmbər nəzərdə tutulur.
[356] Luristan – İranın qərbində tarixi vilayət. Paytaxtı Xürrəmabad şəhəri idi. Əhalisi irandilli lur xalqından ibarətdir.
[357] Türklərin nəzdində doqquz rəqəminin xüsusi əhəmiyyəti vardı *(Nəvai, şərhlər, s.176).*
[358] Rüstəm – Firdovsinin “Şahnamə” məsnəvisinin qəhrəmanlarından olan əfsanəvi pəhləvan Rüstəm Zal.
[359] Ütarid – Merkuri planeti.

Hökmü icra etməkdən yox qorxumuz,
Hökm vermək sizdən, icrası bizdən.
Bizim təmənnamız Kavus[360] mülkü deyildir,
Mərdlikdə məqsədimiz namusdan başqa bir şey deyil".

Qara Yusif onları bir-bir bağrına basıb, hamısını yaxşı vədlərlə şad etdi. Ondan sonra polad geyimli, dəmir libaslı ordu ilə dəmirə qərq olmuş halda, hay-küylü bir şəkildə Təbrizə doğru hərəkətə gəldi və "Səpələnmiş çəyirtkələr kimi"[361] qırx köç mənzilindən sonra Şənbi-Qazan ətrafında dayandı.

Nəzm

"Elə ki gümüş kəməndli bu ay məşəli,
Bu hündür qaladan yerə düşdü.
Göründü üfüqdən aləmi işıqlandıran günəş,
Çıxardı başını yaxasından gündüz".

Qara Yusif külək kimi qaçan və tez dövr edən çərxi-fələk misallı yer kürəsini dolaşan parlaq qara rəngli atına mindi.

Nəzm

"Fələk kimi aləmi dolanan və ay kimi mənzilləri adlayan.
Sabit ulduzlar kimi bələdçilik edən və Ütarid kimi iş bilən.
Onun nalının tozundan yer üzü zireh geyər,
Onun qaldırdığı tozanaqdan asiman örtüyə bürünər".

Sonra isə müzəffər qoşunlarını tərtib etməklə məşğul oldu. O iki ordu bir-birinin qarşısında dayanıb səflər çəkdilər. Hər iki tərəf şeypur çalmağa, nağara və təbil (gübürgə və dühul) vurmağa başladı.

Nəzm

"Təbilçi fələyin qumrusu kimi şövqdən,
Təbilin ipini boynuna taxmış.
Cahan doldu gərənayın[362] naləsi ilə,
Və o nərədən fələk yerindən oynadı.
Bayraqlar baş qaldırdı yuxarı sərv kimi,
Başdan-başa bayraqlar qanad çırpır kəklik kimi".

Nizələrin şimşəyindən, qılıncların parıltısından və oxların işartısından günəşin gözü qamaşdı və xəyalın gözü qaraldı.

Beyt

"Şəfəqdən kam alan nizə çubuqları,
Qan damarını deşən bir alov kimidir".

Mərd igidlər və hərb meydanının bahadırları qəzəbli arılar kimi bir-birinin üstünə tökülüşdülər. İti oxlar adlı-sanlı pəhləvanların barmağından çıxıb uçmağa başladılar.

Nəzm

"Qartal ləléyinin köməyi ilə uçan ox,
Hər igidin könül quşunu ovlayırdı.
Səma dəmbədəm qana bələnmiş mizrağın ucundan,
Ulduzların gözü üçün qırmızı dərman düzəldirdi.
Tənə dilini cövşənə uzatmışdı nizə,
Qılıncın dodağı dəbilqənin şəklinə təbəssüm edirdi".

Qiyamət əlamətli türkman qoşunlarının həmlələri qarşısında Sultan Əhmədin ordusu aciz qaldı. Bu əsnada Qara Yusif Türkman, o cəsur və müzəffər şahsüvar, günəş kimi qılıncını çəkib Sultan Əhmədin üzərinə at çapdı. Allahın köməyinin gücü və padşahın həmləsinin şiddəti Sultan Əhmədin şövkətinin təməllərini

---

[360] Kavus (Key Kavus) – Kəyanilər sülaləsindən olan əfsanəvi İran hökmdarı.
[361] *Qurani-Kərim, "Qəmər" surəsi, 7-ci ayə.*
[362] Gərənay – qədim tarixə malik olan, hərbi yürüşlərdə geniş surətdə istifadə edilən, borusu üzərində heç bir çalğı dəliyi olmayan və gur səs çıxaran nəfəsli musiqi alətlərimizdəndir *(A.İ.Nəcəfzadə. Azərbaycan çalğı alətlərinin izahlı lüğəti. Bakı, 2004, s.91).*

sarsıtdı. Onun ordusu savaş meşəsinin aslanlarından və döyüş zirvəsinin pələnglərindən ibarət olsa da, fərar vadisinə tələsdilər və onların çoxu tale oxundan yaralanmış, zəncir kəməndinə bağlanmış halda yıxılıb-qalxaraq, heyran və sərgərdan olaraq biyaban tərəfə qaçdılar. Sultan Əhməd döyüş meydanında tənha qaldı. Axırda o da qaçış yolunu tutdu. Türkmanlardan biri ona çatıb, iki zərbə vuraraq onu atdan saldı və onun silahını və qiymətli paltarlarını alıb özünü buraxdı. Sultan can qorxusundan bir bağdakı oyuqda gizləndi.

Həmin vaxt ayaqqabıçı (ayaqqabı tikən) bir qoca bir ağacın başına çıxıb o halı müşahidə edirdi. O, ağacdan yerə enib sultana dedi:

- Bu nə haldır?

Sultan dedi:

- Sakit ol və bunu heç kimə söyləmə! Bu sirri məxfi saxla! Bu şəhərdə mənim mülazimlərim çoxdur. Axşam olanda gedib onlardan at istəyərik və Bağdada yola düşərik. Sənə yaxşı ehtiram göstərərəm və Bəqubə[363] bölüyünü sənə verərəm.

Ayaqqabıçı qoca evinə getdi. Onun bir qarısı vardı ki, noxudla fala baxardı. Əhvalatı ona danışdı. O qarı dedi:

- Bizimlə Bağdad və Bəqubə arasında uzun bir yol var. Hal-hazırda oradan bizə bir fayda yetməz. Çox güman ki, axşam onun başına xeyli adam toplaşacaq və onu bir də görməyəcəksən. Yaxşısı budur ki, Qara Yusifin hüzuruna gedəsən, vəziyyəti ona danışasan və yaxşı bir mükafat (cəldu) alasan.

Ayaqqabıçı qoca, arvadının sözünü qəbul edərək Qara Yusifin dərgahına yollandı. O əsnada Qara Yusif Türkman, sultanın miraxurlarını[364] toplamışdı və onlardan sultanın əhvalını, onun yanında neçə at gətirdiyini, indi yanında neçə at ola biləcəyini və onun atlarından neçəsinin öz qoşununun əlinə düşdüyünü soruşurdu. Birdən ayaqqabıçı qoca, Qara Yusifin yanına gəlib dedi:

- Sultan Əhməd filan bağın oyuğunda gizlənmişdir.

Qara Yusif son dərəcə heyrət və sevinclə dedi:

- Bu nə sözdür? Sultan indiyə qədər neçə fərsəx yol qət etmiş olar.

Ayaqqabıçı qoca yenidən israr etdi və dedi:

- Siz etibarlı bir adamınızı göndərin ki, mən onu ona təslim edim.

Qara Yusif onun təkidindən sonra Şeyx Dursunu, Şeyx Hacını, Mahmud İnağı və Satılmışı onunla göndərdi. Onlar sultanı oyuqdan çıxardılar. Sultan çılpaq idi. Ona bir köynək, bir qəba geyindirib başına köhnə bir taqiyə qoydular və bir atın belinə mindirib Qara Yusifin hüzuruna gətirdilər. Qara Yusif qalxıb qarşısında ona yer verdi və dedi:

- Sənin sözünə və əməlinə etimad yoxdur. Dəfələrlə "Qurani-Məcid"ə and içdin ki, bizimlə düşmənçilik etməyəcəksən, lakin etdin.

[Qara Yusif] onun törətdiyi xoşagəlməz hərəkətləri sadaladı. Daha sonra onu yerindən qaldırıb bir küncdə yerləşdirdi. O əsnada Pirbudaq xan məclisə daxil oldu və əmirlər dedilər:

- Sənin ölkən Pirbudaq xana çatacaq. Azərbaycan məmləkətinin Pirbudaq xana təhvil verilməsi haqqında qızıl suyu ilə bir fərman yaz!

Onların təklifinə əsasən, öz xətti ilə fərman yazdı. O zaman Qara Yusif dedi:

- Biz Şah Məhəmmədi Azərbaycanda qoymuşduq. Sən onu [buradan] çıxardın. İndi öz köhnə yerini ona bağışla!

O barədə də öz əli ilə başqa bir fərman qələmə aldı. Məzmunu belə idi: "Bağdadda olan əziz oğullarım Məhəmmədlə Əbülqasim və Tikrit qalası[365] kutvalları bilsinlər ki, Bağdad taxtgahını və İraqi-Ərəb diyarını əziz böyük oğlum Qiyasəddin Şah Məhəmməd Bahadıra verdim. Gərəkdir ki, onun gəlişindən agah olanda, dərhal yaraq və peşkəşlə onu qarşılamağa çıxsınlar, açarları, qalaları və xəzinələri ona təslim etsinlər və müxaliflik qapılarını bağlasınlar".

---

[363] Bəqubə (Baqubə) – İraqda, Nəhrivan yaxınlığında yerləşən bir bölgə. Həmdulla Müstövfi "Nühzətül-qülub" əsərində Bəqubə haqqında yazır: "Mötəbər bir vilayətdir və mərkəzi Bəqubə qəsəbəsidir... Çoxlu bağları və xurmalıqları var" *(Nəvai, şərhlər, s.179).*

[364] Əmiraxur (miraxur) – mehtər, at baxıcısı. Əmiraxurbaşı (miraxurbaşı) – şahın at tövləsinin rəisi, baş mehtər.

[365] Tikrit – İraqda, Samirə şəhərindən 30 mil şimalda, Dəclə çayının qərb tərəfindədir *(Nəvai, şərhlər, s.180).*

Qara Yusif döyüşdə əsir olmuş oyrat əmirlərini, ərəb rəislərini və digərlərini Şah Məhəmmədin mülazimi edib İraqi-Ərəbə göndərdi. Qara Yusif sultana dedi:

- Əhdi pozmağına və mənim qəsdimə gəldiyinə baxmayaraq, səni öldürmürəm.

Əmir Bistam, sultana dedi:

- Sultan Üveysin xanədanını xarab etdin, onun davamçılarını və dövlət ərkanını öldürdün. Səndən dövlətə layiq heç bir iş baş vermədi və verməyəcək.

O, qılıncını belindən sıyırıb, Qara Yusifin önünə ataraq dedi:

- Bu şəxsin həyatı şər və qalmaqal ehtiva etməkdədir və fitnə-fəsada səbəb olmaqdadır. Əgər o, ölümün çəngindən xilas olarsa, böyük bir fitnə törədəcəkdir.

İraq əmirlərinin hamısı birlikdə dedilər:

- Sultan Əhmədə aman vermək məsləhət deyil.

Qara Yusif dedi:

- Əgər mənim ordumda onun kimi lap min adam olsa belə, yenə də əsla narahatlığım olmaz.

Nəzm

"Yetişməz könlümə heç vəchlə təlaş,
Onun kimi əgər min nəfər olsa ordumda".

Mən and içmişdim ki, onu öldürməyim.

Əmir Bistam dedi:

- Sultan Əhməd çoxlu nahaq qanlar axıtmışdır və onun düşmənləri hazırdırlar. Əgər siz ona qəsd etmirsinizsə, heç olmasa himayə də etməyin.

Qara Yusif susdu. İraq əmirləri onu Qazı Şeyx Əli mədrəsəsinə apardılar. Xoca Cəfər Təbrizi diz çöküb ərz etdi ki, "Sultan Əhməd mənim qardaşımı nahaqdan qətlə yetirmişdir". Əmir Bistam şahidlik etdi. İraqlıların təkidi ilə Qara Yusif onun qətlinə fərman verdi. Xoca Cəfər, Satılmışın evində məhbus olan Sultan Əhmədi həlak etdi.

Nəzm

"Əcəl onun vücud evini yıxdı,
Onu taxtdan sonra taxtanın üstünə atdı.
Cahan bu cürə çox işlər gördü,
Bu, zəmanənin etdiyi ilk iş deyildi".

Ertəsi gün əmirlər Qara Yusifin yanına gedib dedilər:

- Sultanı qətlə yetirməyimizə baxmayaraq, camaat güman edir ki, sultan həyatdadır.

Əmir Bistamın məsləhəti ilə sultanın cəsədini Xoca Şeyx Keçəçi mədrəsəsində qoyub üzərinə qara yun [parça] örtdülər. İnsanlar üç gün boyunca ona tamaşa etdilər. Daha sonra onu qardaşının yanında, Dəməşqiyyədə dəfn etdilər[366]. Sultanın döyüşdə iştirak etmiş bəzi oğulları da ölüm şərbəti içdilər[367]. Adilcevaz qalasında məhbus olan Əlaüddövlə də sultanın ardınca yola düşdü[368].

### Rum diyarında baş vermiş hadisələr haqqında söhbət

Bu il Rum padşahı Əmir Süleyman yaxşı nitq qabiliyyətinə malik elçilərini Məhəmməd bəy Qaramanoğlunun yanına yolladı və ona "qardaşım Musa Çələbini tutub [yanıma] göndər!" deyə öz ismarışını çatdırdı. Musa Çələbi bu məktubun məzmunundan agah olduqda, tamamilə kədər içində Qaraman vilayətindən fərar edib Kastamonu (Qəstəmoniyyə)[369] hakimi İsfəndiyarın yanına getdi. Əmir Süleyman Bursadan çoxlu

---

[366] Qardaşı Sultan Hüseyn ibn Sultan Üveysdir. O, 784 / 1382-ci ildə Sultan Əhmədin əmri ilə öldürülmüş və Təbrizin Dəməşqiyyə məzarlığında dəfn edilmişdir. Onun anası da orada torpağa tapşırılmışdır *(Ə.Nəvai, şərhlər, s.181).*

[367] Həmçinin Sultan Əhmədin qardaşı oğlu Şahvələd ibn Şeyx Əli ibn Sultan Üveys də öz əmisi ilə birlikdə Təbrizə gəlmiş və qətlə yetirilərək Dəməşqiyyə məzarlığında dəfn edilmişdi *(Ə.Nəvai, şərhlər, s.181).*

[368] O da Dəməşqiyyədə dəfn edildi *(Ə.Nəvai, şərhlər, s.182).*

[369] Kastamonu – Türkiyədə, Ankaradan şimal-şərqdə və Sinopdan cənub-qərbdə yerləşən şəhər. Kastamonu, XIV əsrin əvvəllərində qurulan Candaroğulları bəyliyinin mərkəzi idi. İsfəndiyar bəy bu bəyliyin ən önəmli bəylərindən olmuşdur. Candaroğulları bəyliyinə 1461-ci ildə Fateh Sultan Məhəmməd tərəfindən son qoyulmuşdur. Bu bəylik bəzən İsfəndiyar və ya İsfəndiyaroğulları bəyliyi də adlandırılmışdır *(Y.Yücel. Candaroğulları // TDVİA, cilt: 7, yıl: 1993, s.146-149; C.Yakupoğlu. İsfendiyar Bey ve zamanı. Gazi Üniversitesi Sosyal Bilimler Enstitüsü, Yayınlanmamış Yüksek Lisans Tezi, Ankara, 1999).*

qoşunlarla İsfəndiyarın vilayətinə doğru yola çıxdı və insanın ruhunu oxşayan bir yerdə eyş-işrət bayrağını qaldırıb, vaxtının çoxunu gül rəngli şərab içməklə, ud və çəng[370] nəğməsini dinləməklə keçirdi. O, bu beytlərin məzmunundan xəbərsiz idi:

Nəzm

“Sultanın başı şərabın təsirindən sallanarsa,
Özündən xəbərsiz şahlıq tacı başından düşər.
Yuxuya aludə olan şahların hamısının işi,
Əndazə bilməməkdən oldu xarab”.

Əlahəzrət əmirlər və dövlət ərkanı onun əhvalının səhifələri üzərində uğurun zavala uğramasının və uğursuzluğun imarətinin yüksəlməsinin əlamətlərini müşahidə etdilər və onun xidmətindən uzaqlaşıb, Əli paşanın və İsfəndiyarın məsləhəti ilə Musa Çələbini gəmiyə mindirərək Əflaqa[371] yola saldılar. O diyarın Mirçe adlı hakimi xeyli peşkəşlə Musa Çələbinin yanına gəlib onu çoxlu qoşunla və saysız yaraqla Ədirnə şəhərinə tərəf göndərdi. Əmir Süleyman da Ədirnəyə getdi. O əsnada Musa Çələbi cəsurluq yolunun yolçularından ibarət bir dəstə ilə qəflətən onun üzərinə töküldü. O, naçar şəkildə fərar yolunu tutdu. Yolu bir kəndə düşdü. O kəndin camaatı onu qətlə yetirdi. Səltənət Musa Çələbinin əlində qərar tutdu. O, vəzirliyi[372] Kor Məlikşaha həvalə etdi, əmirülümərallığı Mixaloğlu bəyə tapşırdı, Qazı Bədrəddini qazı-əsgər[373] [təyin] etdi və bütün Rum əmirlərini əmirlikdən azad etdi.

Əmir Süleymanın qətli xəbəri qardaşı Sultan Məhəmmədə çatdıqda Amasya şəhərində öz adına xütbə oxudub sikkə vurdurdu. Ondan sonra çoxlu ordu və hədsiz bir qələbəlik və təntənə ilə hərəkət bayrağını Bursa tərəfə qaldırdı. O hüduda gəldikdən sonra böyüklər, əyan-əşrəflər, sənətkarlar və əsnaflar[374] onu qarşılamağa tələsib qala açarlarını təslim etdilər. Sultan Məhəmməd o şəhəri darülmülk (paytaxt) edib orada qışladı.

## Mavəraünnəhrdə baş vermiş hadisələr və Şahrux padşahın Əmir Şeyx Nurəddinlə müharibə etməsi haqqında söhbət

Bu il savaş dənizinin nəhəngi Sarı Buğanın oğlu Əmir Şeyx Nurəddin hərəkət bayrağını Səmərqəndə doğru qaldırdı. Əmir Şahməlik, Bəhram kimi qəhredici bir ordu ilə şəhərdən çıxıb döyüşə və vuruşa hazır oldu. Qızıl-Ribatda o iki qoşun qarşılaşdı. Şeyx Nurəddinin tərəfində çoxlu təpələr vardı və onun ordusu tam olaraq görünmürdü. Əmir Şeyx Nurəddin sol və sağ cinahları mərkəzə birləşdirib bir anda hücuma atıldı. Səmərqənd qoşunları o həmləyə tab gətirməyib qaçış yolunu tutdular. Əmir Şeyx Nurəddinin ordusu onları təqib edib Əmir Vəfadarı əsir tutdu. Əmir Şahməlik Keş və Səmərqənd arasında yerləşən Alaqısraq dağına sığındı.

Əmir Şeyx Nurəddin belə bir qələbədən sonra zilhiccə ayının 16-da (11.04.1411)[375] Səmərqənd ətrafında məskən saldı. Şəhərlilər onun mülazimlərindən çoxunu ox zərbəsi ilə gedər-gəlməzə göndərdilər. Əmir Şeyx Nurəddin, Əmir Toğay Buğanı Buxaraya hakim [təyin edib] göndərdi, Çingiz-oğlanı isə Keş tərəfə yolladı. O zaman Əmir Xudadad Hüseyninin oğlu, Əmir Şeyx Nurəddindən icazəsiz öz ölkəsinə getdi. Əmir Şeyx Nurəddinin müxalifliyinin xəbəri Heratda müzəffər padşahın qulağına çatdıqda ali fərman verildi ki, Əmir Mizrab Bahadır, Əmir Təvəkkül Barlas, Əmir Yadigarşah Orlat, Məhəmməd Sufi Tərxan, Əmir Yusif Xoca, Əmir Əcəbşir və Əmir Nuşirəvan Barlas müzəffər qoşunların hərəkətindən öncə Mavəraünnəhrə yönəlsinlər və Əmir Şeyx Nurəddini bəla toruna giriftar etsinlər. Əmirlər buyruğa uyğun olaraq yola düşdülər

---

[370] Çəng – qədim simli çalğı aləti. Müasir arfanın “əcdadı” hesab edilir (*A.İ.Nəcəfzadə. Azərbaycan çalğı alətlərinin izahlı lüğəti, s.60-61).*

[371] Əflaq – Valaxiya (Rumıniyada tarixi bir vilayət).

[372] Vəzir – mülki bürokratiyanın başçısı.

[373] Qazı-əsgər – orduda şəriət qanunlarını icra edən şəxs.

[374] Əsnaf – ərəbcə “siniflər” deməkdir. Orta əsrlərdə Yaxın Şərqin bir sıra ölkələrində, o cümlədən də Azərbaycanda sənətkarların birləşdikləri sex təşkilatları və onların üzvləri əsnaf adlanırdı (daha ətraflı bax: *М.Х.Гейдаров. Социально-экономические отношения, с.45-87*).

[375] Bəlkə də, burada söhbət 812-ci ilin zilhiccə ayının 16-dan (21.04.1410) gedir.

və hökmdarın məiyyəti səhranın qumundan daha artıq sayda bir ordu ilə Mavəraünnəhrə doğru hərəkətə gəldi.

Nəzm

“Kin ahəngi ilə ölkə fəth edən şah,
Səadət atını yerindən oynatdı.
O, döyüş çölündə qaldırdığı tozla,
Səmanı ağırlaşdırıb yerə vurdu”.

Şahrux padşahın hərəkətindən xəbər tutan kimi Əmir Şeyx Nurəddin Səmərqənd ətrafından çay qırağına yollandı. Əmir Şahməlik şəhərin süvarilərini və piyadalarını toplayıb əzəmətli orduya yollandı. Əmir Şeyx Nurəddin qəflətən o güclü qoşuna həmlə edib, onları pərən-pərən salaraq istilaçılıq bayrağını yüksəltdi.

Nəzm

“Asimandan gələn bir bəla kimi,
Çökdü onların üstünə qəflətən”.

Əmir Şahməlik pərişan və bədhal vəziyyətdə müzəffər orduya çatdı və yol əsnasında Mirzə Əhməd Mirək beş yüz süvari ilə ona qoşuldu. Onlar birlikdə aləmin pənahı olan dərgaha gəldilər.

Əmir Şeyx Nurəddin qəzəb və kinlə qələbəyə yaxın olan ordunun qarşısına çıxdı. Şənbə günü, sözügedən ilin rəbiüləvvəl [ayının] 9-da (12.07.1410) Qızıl-Ribat ətrafında böyük bir döyüş baş verdi. Əmir Xudadadın bir oğlu müxaliflər tərəfində mərdliklə döyüşürdü. Mirzə Əhməd Mirək irəli gedib onu qovdu. Şahrux padşah qorçularla birlikdə həmlə etdi.

Nəzm

“Cilvəyə gətirdi qara atını,
Kəskin bir atəşi alovlandırdı.
Kükrəyən bir aslan kimi şan-şövkət ilə,
Meydana daxil oldu igid cəngavər”.

Əmir Şeyx Nurəddin fərar yolunu tutdu. Qələbə şüarlı qoşunlar o yaramaz qövümdən bir çoxlarını əsir edib, kama çatmış padşahın dərgahına gətirdilər. Onların bir qismi cəzaya (edama) layiq olsa da, o həzrət mərhəmətinin bolluğu üzündən hamısına rəhm etdi və qayıdış bayrağını Herata doğru qaldırdı.

## Fars və İraq bölgələrində baş vermiş hadisələr və Mirzə Rüstəmin Mirzə İsgəndərlə müharibə etməsi haqqında söhbət

Bu il Mirzə İsgəndər Şirazdan İraqa yönəldi. O, Əmir Əbdüssəmədi və Əmir Sədiqi bir dəstə süvari ilə İsfahana yolladı. Onlar Vərzənə qəsəbəsini zəbt etdilər. Mirzə Rüstəm qoşun və məiyyətlə qalanı mühasirəyə aldı. Mirzə İsgəndər, Əmir Tüləklə Əmir Yusif Cəlili mühasirədəkilərin köməyinə göndərdi. Bu xəbəri eşidən Mirzə Rüstəm dərhal ata minib onların üzərinə sürətli yürüş etdi. Əmirlər son dərəcə iztirabla özlərini xaraba Dəstcərd qalasına saldılar.

Bu əsnada [Mirzə Rüstəm] Bayqara ilə birlikdə Dəstcərdə yönəldi. O zaman Mirzə İsgəndər sürətli yürüş edərək ali mənşəli şahzadələrə çatdı və döyüşə başladı. Dava-dalaşdan sonra Mirzə Rüstəm qaçış yolunu tutub can qorxusundan özünü İsfahana yetirdi. Mirzə İsgəndər məiyyət və ordu ilə Atəşgah mövqeyində dayandı.

Mirzə Rüstəm, Xəlil sultanın[376] yanına elçilər göndərib ondan yardım istədi. Ona görə də Xəlil sultan bir dəstə igidlə İsfahana gəldi. Bir neçə gündən sonra Mirzə Rüstəm öz gücsüzlüyü üzündən İsfahanı tərk edib Azərbaycana yola düşdü. Mirzə İsgəndər onu təqib etmək üçün bir dəstə göndərdi. Onlar Quma[377] qədər getsələr də, onun tozuna belə çata bilmədilər. Xəlil sultan İsfahanı zəbt etdi. O əsnada Şul (Şulistan)[378] camaatından və kürdlərdən ibarət bir dəstə Mirzə İsgəndərin izni olmadan köç etdi. Mirzə İsgəndər də naçar

[376] Xəlil sultan – Mirzə Miranşahın oğlu idi. O, Şahruxun əmrinə əsasən, atasının mülkünə sahib çıxmaq üçün on minlik qoşunla İraqi-Əcəm və Azərbaycan üzərinə göndərilmiş və Reydə yerləşmişdi *(Nəvai, şərhlər, s.186).*
[377] Qum – İranda, Tehrandan cənub-qərb tərəfdə şəhər.
[378] Şulistan – Fars vilayətinin bir bölgəsidir. Şirazdan şimal-qərbdə yerləşir *(Seddon, şərhlər, s.219).*

qalıb, qalanın ətrafından qalxaraq Şiraza yönəldi. Xəlil sultan İsfahanda qıtlıq baş qaldırdığı üçün Rey tərəfə yola düşdü.

**Müxtəlif əhvalatlar**

Bu il Mirzə Rüstəm Təbrizə gəldi. Qara Yusif ona böyük hörmət göstərdi.

Həmçinin bu il Əmir Edigenin elçisi Dəşti-Qıpçaqdan üfüqlər padşahı Şahrux sultanın dərgahına gəldi. Həmçinin Şirvan padşahının elçisi də Herata gəldi. O həzrət onlara ehtiram göstərib geri qayıtmaq üçün icazə verdi.

**Ölümlər**

Padşah Sultan Əhməd ibn Sultan Üveys ibn Şeyx Həsən Bozorg ibn Əmir Hüseyn Gürkan ibn Əmir Ağbuğa ibn İlka Noyan Cəlair [bu il öldü]. Sultan Əhməd zalım, qorxusuz, fitnəkar və qantökən bir padşah idi. Daşürəkli olması ilə tanınmış, rəhmsizliyi ilə məşhurlaşmışdı. Dost və düşmən ondan qorxardı. Onun gözündə doğma və yad eyni idi. Elmlərdən xəbərdar idi və musiqidə sənət sahiblərinin öndəgedəni idi. Beyninin kütlüyü əməlində peyda və düşüncəsinin azlığı hərəkətlərindən və davranışlarından aşkar olurdu.

Nəzm

"Tiryəkdən pozulmuş bir beyni vardı,
O üzdən də sözü və əməli xoşagəlməz idi.
Əməli ağıl tövründən uzaq idi,
Sözündə dürüstlük yox idi".

Tiryəkə düşkünlüyü və dəliliyinin çoxluğu ucbatından əmirləri və dövlət ərkanını yeri gəldi-gəlmədi qətlə yetirərdi. Saqqalsızların, saz əhlinin və xoş avazlı oxuyanların söhbətinə böyük meyli vardı. Amma rəml[379] elmində əvəzsiz idi. Rumi türkcəsindəki tarix əsərlərində qeyd edilmişdir ki, Sultan Əhməd, İldırım Bayəzidə pənah aparan zaman Rum padşahı ondan özü ilə Sahibqiran Əmir Teymur Kürəkan arasında nə baş verəcəyinə dair rəml çəkməsini istəmişdi. Sultan Əhməd rəml atdıqdan sonra dedi: "Hər ikiniz kiçik bir xalçaya oturub, iki dəfə qatıq yeyəcəksiniz". Sultanın dediyi kimi də oldu[380]. Xoca Hafiz Şirazi, Sultan Əhmədin mədhi haqqında belə deyir:

Nəzm

"Allahın sevimlisi, ədalətli sultan,
İlkani Həsən oğlu Şeyx Üveysin övladı Əhməd.
Ay əgər sənsiz doğarsa, onu ikiyə bölərlər,
Sən Əhmədinin[381] dövləti ilə Tanrının möcüzəsisən".

Səltənət müddəti otuz iki il idi[382]. Məmləkəti bəzi vaxtlarda Azərbaycan, bəzi vaxtlarda isə İraqi-Ərəb idi. Amma əksər zamanlarda Sahibqiran Əmir Teymur Kürəkanın qaniçən qılıncının qorxusundan cahanın ətrafında heyran və sərgərdan gəzirdi. Öz səltənəti əyyamında dörd döyüş etmişdi: ilk vuruşması Adil ağa ilə, ikincisi şahzadə Pir Əli ilə, üçüncüsü Naxçıvanın şoranlığında Teymur Kürəkanın əmirləri ilə, dördüncüsü isə Şənbi-Qazanda Qara Yusiflə olmuşdur. Bütün bu döyüşlərdə məğlubiyyətə uğramışdır.

Sultanın qətli xəbəri Şahrux padşaha çatdıqda, illərlə sultanın xidmətində olmuş xanəndə Xoca Əbdülqadiri çağırıb dedi:

- Sultan Əhmədin qətli barəsində nə söylərsən?

Xoca bu rübaini nəğməyə çəkib dilə gətirdi:

Nəzm

"Əbdülqadir, gözündən hər dəm qan axıt,
Cəfakar çərxi-fələklə daha dalaşma.

---

[379] Rəml elmi – qum üzərində fala baxmaq üsuludur.
[380] Bilindiyi kimi, 1402-ci ildə Ankara döyüşündə Əmir Teymur, İldırım Bayəzidə qalib gələrək onu əsir aldı.
[381] Məhəmməd peyğəmbər nəzərdə tutulur.
[382] Əsərin son Tehran çapının bu hissəsində (s.187) naqislik vardır. Belə ki, orada İldırım Bayəzidlə Sultan Əhmədin söhbəti və Hafiz Şirazinin bu şeiri yer almamışdır.

Çünki o sərvərlik səmasının günəşi qəflətən öldü,
Ölümün tarixi oldu "qəsdi-Təbriz" ("Təbrizin qəsdi")"[383].

İlkaniyyə (Cəlairi) sultanlarının dövləti süquta uğradı. Bu sülalədən bu minvalla dörd nəfər səltənət sürmüşdür: Əmir Şeyx Həsən Bozorg, Sultan Üveys, Sultan Hüseyn və Sultan Əhməd. Onların səltənətlərinin müddəti yetmiş dörd il olmuşdur.

Sultan Əhmədin qətlindən sonra Sultan Məhəmməd ibn Şahvələd ibn Şeyx Əli ibn Sultan Üveys Bağdadda qərar tutdu. O əsnada Qara Yusifin oğlu Şah Məhəmməd Ərbili[384] ondan aldı.

## 814-CÜ İLDƏ (25.04.1411 – 12.04.1412) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Rum diyarında baş vermiş hadisələr və Sultan Məhəmmədin Musa Çələbi ilə müharibə etməsi

Bu il Sultan Məhəmməd istədi ki, qardaşı Musa Çələbinin üstünə getsin. Buna görə də Bayəzid paşanı çağırıb dedi:

- Çoxlu qoşunlarla bu bədkirdar zalımı dəf etmək üçün tələsmək lazımdır. Çünki iki qılınc bir qına sığmaz və bir yaydan iki ox atmaq olmaz. Gərək sudan keçid yeri tapasan ki, Ədirnəyə yollanaq.

Buna görə də əmirlər məşvərətdən sonra Şahməlikin məsləhəti ilə Qazı Fəzlullanı İstanbul valisinin[385] yanına göndərib ondan gəmi istədilər və o diyarın hakimi onlar üçün çoxlu gəmi göndərdi. Musa Çələbi bu xəbəri eşitdikdən sonra vilayəti tərk edib Las diyarına[386] qaçdı. Əli bəy Evrenosoğlu və Əli bəy Mixaloğlu[387], Musa Çələbidən üz döndərib, Sultan Məhəmmədə xidmətkarlıq ehramını bağlayaraq onun dərgahına tələsdilər. Buna görə də Musa Çələbi Las diyarında qərar tuta bilməyib başqa bir yerə getdi. Əksər əmirlər onun yanından fərar edib Sultan Məhəmmədə qoşuldular. Belə ki, axtaçıdan başqa onun xidmətində heç kəs qalmadı. Sultan Məhəmməd Ədirnədən keçib Sofiyaya[388] gəldi. Musa Çələbi igidlik meydanının bahadırlarından ibarət bir dəstə ilə sultanın qarşısında səf çəkdi. Mərd igidlər və savaş meydanının bahadırları bir-birinə qarışdılar və bir-birinin başına qılınc ("tiğü-şəmşir") vurdular. İti qılıncların gövhərləri adlı-sanlı igidlərin qanından qırmızı yaqut rəngini aldılar, atəş yağdıran oxlar isə güclü sərkərdələrin ürəyinin yanğısından Bədəxşan[389]ləlinin rənginə döndülər. Meydanın tozu Fərqədan[390] [ulduzlarının] başına qondu.

Nəzm

"Bəhmən kimi heybətli süvarilərin tozundan,
Yer göyə qalxdı, göy yerə endi.
O tozanaqda, cahanı gəzən atlar,
Atəşin altındakı kül kimi görünməz oldu".

Axırda [Allahın] əbədi lütfü və sonsuz qayğısı Sultan Məhəmmədin halına şamil oldu. Musa Çələbinin ordusu çini kasa kimi sınıb dağıldı, onun özü isə fərar yolunu tutdu. Sultan Məhəmmədin ordusu onu təqib edib əksər mülazimlərini itinəfəs qılıncın zərbəsi ilə gedər-gəlməzə göndərdilər. Qaçış əsnasında əzəmətli Tanrının təqdiri ilə Musa Çələbinin atı palçığa batdı. Onun atını təqib edən Saruca adlı qulam onu tutub Sultan Məhəmmədin hüzuruna gətirdi və onun fərmanı ilə öldürüldü. Onun mülazimlərinin əksəri aləmin ət-

---

[383] Burada tarix əbcəd hesabı ilə göstərilmişdir. Əbcəd – klassik ədəbiyyatda sayları ifadə etmək üçün rəqəmlərdən savayı, bəzən hərflərdən də istifadə olunur və bu hesablama üsuluna "əbcəd hesabı" deyilir. Əbcəd hesabına əsasən, ərəb əlifbasına daxil olan 28 hərfin hər biri müəyyən ədədi ifadə edir. Əbcəd hesabından ayrı-ayrı şəxslərin təvəllüdü və vəfatını, əsərlərin yazıldığı və ya bitdiyi ili, əlamətdar hadisələrin tarixini göstərmək üçün poeziyada istifadə olunmuşdur. "Qəsdi-Təbriz" = 813 h.

[384] Ərbil – Şimali İraqda, Böyük və Kiçik Zab çayları arasında yerləşən şəhər.

[385] İstanbul valisi adı altında Bizans imperatoru II Manuil nəzərdə tutulmuşdur *(Nəvai, şərhlər, s.189).*

[386] Las (Laz) diyarı – Lazar Qrilyanoviçin və övladlarının hakimiyyəti altında olan Serbiya torpaqları nəzərdə tutulur.

[387] Türklərin Kosa Mixal adlandırdıqları Mixail adlı bir yunan sərkərdəsi Osmanlı dövlətinin banisi Osman Qazi zamanında islamı qəbul etmiş və onun nəslindən olanlar Mixaloğlu adı ilə tanınaraq Osmanlı dövlətində yüksək mənsəblər daşımışlar *(Nəvai, şərhlər, s.189).*

[388] Sofiya – indiki Bolqarıstan Respublikasının paytaxtı.

[389] Bədəxşan – indiki Tacikistanın şərqini və Əfqanıstanın şimal-şərqini əhatə edən tarixi vilayət. Qiymətli qırmızı yaqut (ləl) mədənləri ilə məşhur olan bu vilayətin adı klassik Şərq ədəbiyyatında dönə-dönə tərənnüm olunmuşdur.

[390] Fərqədan ulduzları – Şimal qütbünə yaxın, Kiçik Ayı bürcündə iki parlaq ulduz.

rafına və yan-yörəsinə təfriqə və pərakəndə oldular. Əzəb bəy Əflaq hakiminə pənah apardı. Simavna qazısı[391] ilə Məhəmməd bəy Mixaloğlu isə əsir tutuldular. Sultan Məhəmməd bütün Rumeli vilayətini ələ keçirdi.

### Məhəmməd bəy Qaramanoğlunun Bursa şəhərini mühasirə etməsi haqqında söhbət

Sultan Məhəmmədin Musa Çələbinin üstünə getdiyi zaman Qaramanoğlu da müxaliflik edib hərəkət bayrağını Bursaya doğru qaldırdı. Yol əsnasında Sivrihisarı[392] ("Hisari-Sivri") ələ keçirib Bursa ətrafına gəldi.

Hacı Əvəz paşa şəhərətrafı bölgələrin (bölükat) əhalisini şəhərə gətirdi və qala müdafiəsi ləvazimatını mükəmməl bir tərzdə tərtib etdi. O əsnada Qaramanoğlu izdihamlı ordu ilə qalanı bir mərkəz kimi dövrəyə alıb bütün şəhəri yandırdı və xəndəyə su buraxdı. Əvəz paşa içəridən lağım vurub suyu başqa bir tərəfə yönəltdi. O əsnada xəbər gətirdilər ki, Musa Çələbinin cəsədini Bursadakı əcdadlarının məqbərəsində dəfn etmək üçün Kaplucaya ("Qapuluca") gətirmişlər. Ona görə də Qaramanoğlunun ürəyini tamamilə qorxu bürüdü. O, Bursanın ətrafından köçüb öz diyarına tərəf fərar etdi. Yanında olan nədimi ona dedi:

- Biz Rum padşahının ölüsündən belə qaçırıqsa, onun dirisi gəlsəydi bizim halımız nə cür olacaqdı?

Məhəmməd bəy Qaramanoğlunun müxalifliyi xəbəri Sultan Məhəmmədə çatdıqda çoxlu ordu və aslan ovlayan igidlərlə, İsfəndiyaroğlu və Gərmiyan[393] valisi ilə birlikdə Qaraman diyarına yönəldi. Akşehir[394] (Ağşəhər) ətrafı Bəhram kimi qəhredici qoşunların dayanacaq yerinə çevrildikdə qalibiyyətli qoşun (çərik) bir həmlədə o şəhəri ələ keçirdi. O şəhərin fəthindən sonra Konya tərəfə yollandı. O tərəfdən Məhəmməd bəy cürət edib, savaş meydanına qədəm qoyaraq çox döyüşdü. Axırda üləmanın məsləhəti ilə iki tərəfin kinküdurəti sülh və səfa ilə əvəzləndi. [Məhəmməd bəy Qaramanoğlu] Bəyşəhri, Sivrihisarı və Nigdeni[395] ona təslim etdi.

Sultan bəxşiş caməxanasından (qarderobundan) onun qabiliyyət qamətinə ənam və ehsan bəxşişi geydirdikdən sonra öz diyarına yola düşdü. Beləliklə, Sultan Məhəmməd Bursaya qayıtdı.

### Müxtəlif əhvalatlar

Həmçinin bu il Şahvələd oğlu Sultan Məhəmməd Bağdad valisi idi. Əmisindən sonra onunla yaxınları arasında ixtilaf çıxdı[396]. Bu vaxt Qara Yusif oğlu Şah Məhəmməd Ərbildə idi. O, Bağdaddakı pərişanlığı eşitdikdən sonra oraya sürətli yürüş edib gözlənilmədən Suqüs-sultan (Sultan bazarı) darvazasına gəldi. Tale elə gətirdi ki, Sultan Əhməd dövründə [Bağdadın] daruğası[397] olmuş Əmir Bəxşeyiş həmin vaxt Sultan [Məhəmməd] tərəfindən oranın şihnəsi[398] olan Əbdürrəhim Məllahı qətlə yetirdi və orada çaxnaşma baş qaldırdı. Sultan Məhəmməd Şüştərə qaçdı və Bağdad şəhəri Şah Məhəmmədin əlinə keçdi.

Həmçinin bu il Mirzə Rüstəm Təbrizə gəldi. Qara Yusif ona böyük hörmət və ehtiram göstərdi. Onu İraqa göndərmək üçün Marağaya getdi və onunla oradan çoxlu qoşun yolladı.

Bu il Dəşti-Qıpçaq padşahının elçiləri və Şirvandan Əmir Şeyx İbrahimin nümayəndələri Şahrux sultanın dərgahına gəldilər.

---

[391] Simavna qazısı adı altında Qazı Bədrəddin Mahmud nəzərdə tutulmuşdur. Simanva – Anadoluda, Kütahya əyalətində bir şəhərdir *(Nəvai, şərhlər, s.190)*.

[392] Sivrihisar – Ankara ilə Eskişehir arasındadır.

[393] Gərmiyan – XIII əsrin sonlarında Kütahya və ətrafında qurulmuş türk bəyliyi *(M.Ç.Varlık. Germiyanoğulları // TDVİA, cilt: 14, yıl: 1996, s.33-35)*.

[394] Akşehir – Konyadan şimal-qərbdə yerləşən şəhər.

[395] Beyşehir – Konyadan qərbdə yerləşən Beyşehir gölünün cənub-şərq sahilində şəhər; Niğde – Konyadan şərqdə və Kayseridən cənub-qərbdə yerləşən şəhər.

[396] "Mətləüs-səadeyn"ə görə, Sultan Əhmədin ölümündən sonra şahzadə Vələd ibn şahzadə Şeyx Əli ibn Sultan Üveysin övladları Sultan Məhəmməd və Sultan Üveys Bağdadın hakimi oldular və onların arasında böyük bir ixtilaf meydana gəldi *(Nəvai, şərhlər, s.192)*.

[397] Daruğa – moğolca "rəis" deməkdir. Şəhər idarəçiliyinin başında duran məmur "daruğa" adlanırdı. Daruğa şəhərin inzibati və hərbi-siyasi rəhbəri sayılırdı. Onun ixtiyarında silahlı dəstələr olurdu. Bundan əlavə, bazar daruğası, dəftərxana daruğası, mühasibat daruğası, fərraşxana daruğası kimi vəzifələr də vardı (bax: *V.F.Minorsky. "Tadhkirat al-Muluk": A Manual of Safavid Administration circa 1137 / 1725. London, 1943, p.141; Ş.K.Məmmədova. "Xülasətüt-təvarix" Azərbaycan tarixinin mənbəyi kimi, s.55; М.Х.Гейдаров. Социально-экономические отношения, с.84-85,132; З.Г.Байрамов. Местное и городское управление, с.17-19*).

[398] Şihnə – bugünkü deyimlə polis rəisi anlayışına uyğun gəlir.

## 815-Cİ İLİN (13.04.1412 – 02.04.1413) HADİSƏLƏRİ

### Mavəraünnəhr diyarında baş vermiş hadisələr haqqında söhbət

Bu il Şahrux padşahın fərmanı ilə Əmir Şahməlik ramazanın (05.12.1412 – 03.01.1413) ortalarında Səmərqənddən Səvrana[399] hərəkət etdi və Əmir Musaka ilə Əmir Tərxanı bir dəstə igidlə mənqəlay qaydasında irəli göndərdi. Əmir Şeyx Nurəddin kin meydanının bahadırlarının gəlişindən xəbər tutduqda fərar edib Moğolustan hakiminə pənah apardı[400]. Mənqəlay əmirləri ardınca gedib onun vilayətini qarət etdilər. O əsnada Əbdülxaliq onun üstünə gəlib onun adamlarını pərən-pərən saldı. Əmir Şeyx Nurəddin, Xızır Xoca-oğlanın oğlu Məhəmməd xanın yanına getdi və göstərdiyi çoxlu səylər nəticəsində Əmir Şahməlikin elçilərini tutdurmağa nail oldu. [Məhəmməd xan] o yaramaza on bir min süvari verib Mavəraünnəhrə göndərdi. Onlar Seyram qalasını[401] mühasirə etdilər.

Əmir Şahməlik çoxlu qoşunla moğolların və Əmir Şeyx Nurəddinin üzərinə hərəkət etdi. O, Şayəstəmi iki min süvari ilə onların ailələri və köçləri üzərinə göndərdi və moğolların ailələrini və köçlərini qarət etdilər. Bu haldan xəbər tutan moğollar pərən-pərən düşdülər. Əmir Şahməlik Moğolustana yollandı. Əmir Şeyx Nurəddin, Məhəmməd xanın köməyindən ümidini üzüb Çingiz-oğlanın yanına elçi göndərdi və xahiş etdi ki, Əmir Şahməlikin yanına adam göndərib onun günahının bağışlanmasını istəsin. Çingiz-oğlan dərhal öz nökərlərindən Ramazan Özbəyi Əmir Şahməlikin yanına göndərib sülhdən söz saldı. Amma baş tutmadı. Əmir Şahməlik Səvrana gəldi və iki nökərlə Əmir Şeyx Nurəddinin yanına getdi. Onun da yanında iki nökər vardı. Hərçənd [Əmir Şahməlik] "düşmənçiliyi tərk et!" deyə nəsihət etsə də, [Əmir Şeyx Nurəddin] qəbul etmədi. Əmir Şahməlik öz ordusuna gəldi. Əmir Şeyx Nurəddin iki nəfərlə[402] qalanın yaxınlığında dayanmışdı. Əmir Şahməlik Hərqüdaqa dedi:

- Sən mənim qardaşım yerindəsən. Əgər cürət qədəmini irəli qoysan və ona həmlə etsən, sənin bahadırlığın aləmdə məşhur olacaqdır və Şahrux padşah da sənə böyük hüsn-rəğbət göstərəcəkdir.

Hərqüdaq qəbul edib, qalanın qapısına gedərək atdan endi. Bir neçə dəfə diz çökdü. Əmir Şeyx Nurəddin də əyilib onu qucaqladı. Elə ki Hərqüdağın iki əli Əmir Şeyx Nurəddinin arxasında bir-birinə yetişdi, var gücü ilə onu atdan aşağı çəkdi və yerə düşdüyü vaxt dizini onun sinəsinə qoyub qılıncını belindən sıyırdı. Əmir Şeyx Nurəddinin qalanın bayırında olan iki nökəri onun üstünə cumdular və birisi onun biləyinə qılınc vurdu. Hərqüdaq, Əmur Şeyx Nurəddini dizinin altında saxlayıb həmin süvariyə qılınc çaldı. Elə vurdu ki, onun atının dodaqları kəsildi. Onların atlarını hürkütdükdən sonra Əmir Şeyx Nurəddinin üzünə qılınc vurdu. Belə ki, onun qılınca mane olmaq istəyən əlinin barmaqlarının ucu kəsilib qopdu. Əmir Şahməlik uzaqdan baxırdı. Hərqüdaq başını qaldırdıqda Əmir Şahməlik iki yüz süvari ilə basqın edib qalanın qapısına çatdı. Hərqüdaq hələ Əmir Şeyx Nurəddinin sinəsinin üzərində idi. Kömək gəlib çatdıqda ayağa qalxıb daha bir qılınc zərbəsi ilə onun başını [bədənindən] ayırdı. Əmir Şahməlik Səvranı mühasirəyə aldı. O əsnada Həzrət Şahrux onu geri çağırdı ki, "qala əhli səndən qorxur; sən bizim yanımıza gəl və birisini göndərib onları hüzurumuza tələb edək". Əmir Şahməlik hökmdarın ordusuna gəldi. Həzrət Şahrux Mavəraünnəhrdən qalxıb Herata yollandı[403].

---

[399] Səvran – Sırdərya (Seyhun) çayı sahilində, Yəsi şəhərindən (Qazaxıstanın indiki Türküstan şəhərindən) şimala doğru bir günlük yol məsafəsində yerləşirdi *(Nəvai, şərhlər, s.193).*

[400] Əmir Nurəddin – Teymurun cəsur sərkərdələrindən idi. Teymurun ölümündən sonra onun dul arvadı Tuman ağa ilə evlənmişdi. Lakin o, Şahruxun Uluğ bəyi Mavəraünnəhrdə qoymasından və oranın bütün idarəçilik işlərini Şahməlikə həvalə etməsindən narazı qalmış və qiyam qaldırmışdı. Çünki Şahməlik onun köhnə rəqibi idi *(Nəvai, şərhlər, s.194).*

[401] Seyram – qədim adı İspicab olan bu tarixi şəhər Təraz şəhərindən 80 mil cənub-qərbdə yerləşirdi. Təraz şəhərinin xarabalıqları indiki Övliya-ata (Cambul) şəhəri yaxınlığındadır *(Nəvai, şərhlər, s.193).*

[402] Tehran çapında səhvən "iki min nəfər" yazılmışdır.

[403] "Mücməli-Fəsihi" və "Mətləüs-səədeyn"də Şeyx Nurəddinin qətli h. 814-cü ilin hadisələri içində verilmişdir *(Nəvai, şərhlər, s.195).*

### Fars vilayətində baş vermiş hadisələr haqqında söhbət

Bu il Mirzə İsgəndər Kirmana yönəlib, Bəm və Gərmsirata[404] basqın üçün bir dəstə göndərdi. Özü isə bir dəstə igidlə Kirman ətrafında dayandı. Ordunun bir hissəsini də Sircanı[405] mühasirə etməyə qoymuşdu. Qala camaatı qəflətən onların üzərinə gecə basqını edib hamısını pərən-pərən saldılar. Mirzə İsgəndər qaçanları cəzalandırdı və Sultan Hüseyn Barlası Sircan camaatını dəf etməyə yolladı. Onlar arasında çox ağır bir hərb baş verdi. Sircanlılar məğlub oldular. Onlar (Sultan Hüseyn Barlasın əsgərləri) müzəffər və qalib şəkildə Mirzə İsgəndərin ordusuna gəldilər. Kirmanlılar Mürtəzayi-Əzəm Şəmsəddin Bəmini aman istəməyə göndərib, mal və xərac[406] [verməyi] qəbul etdilər. Ona görə də Mirzə İsgəndər sülh edib Şiraz tərəfə qayıtdı.

Mirzə Rüstəm İsfahana çatdıqda Xoca Əhməd Saidi digər böyüklərlə birlikdə onu qarşılamağa gəldi. Mirzə iki ay müddətində orada vaxt keçirdi və Xoca Əhməd Saidini Qurban bayramı günündə qətlə yetirdi. Ona görə də şəhərlilər müxaliflik etməyə başladılar. Həmin zaman Mirzə İsgəndər İsfahan ətrafına yetişdi. Mirzə Rüstəm naçar qalıb Xorasana yollandı.

### Müxtəlif əhvalatlar

Bu il Hindistan elçiləri Xızır xanın[407] yanından bol töhfələr və Moltan[408] qazısı ilə birlikdə Şahrux sultanın dərgahına gəldilər və Həzrət Şahruxun şöhrətli adına zərb etdikləri bir neçə qızıl sikkə gətirdilər.

## 816-CI İLİN (03.04.1413 – 22.03.1414) HADİSƏLƏRİ

### Qara Yusif Türkmanın Şirvan padşahı Sultan İbrahimlə müharibə etməsi

Sultan Əhməd Cəlair Təbrizə hərəkət etdiyi vaxt Şirvan valisi Şeyx İbrahimdən kömək istəmişdi. Ona görə də Şeyx İbrahim öz oğlu Kəyumərsi böyük bir qoşunla sultana köməyə göndərmişdi. Şirvanlılar döyüş günü ordugahın yaxınlığında dayanmışdılar. O əsnada türkman ordusunun döyüşə getməmiş olan bir dəstəsi onların üzərinə tökülüb, onu dustaq edərək Qara Yusifin yanına apardılar. Bu xəbər Şirvana çatdıqda, Şeyx İbrahim türkman hökmdarının dərgahına bol töhfələrlə elçilər göndərib oğlunun [geri verilməsini] istədi. Qara Yusif dedi:

- Şirvan Azərbaycan civarında yerləşir. Şeyx İbrahim isə Bağdad hakimi ilə məhəbbət və ittihad edərək Təbriz valisinə qarşı müxaliflik edir.

Lakin axırda mərhəmətinin çoxluğundan onun qanının üstündən keçib onu çoxlu mallarla Şirvan hakiminin yanına göndərdi. Bir müddət sonra isə Şeyx İbrahim öz oğlu Kəyumərsə Qara Yusifin tərəfdarlarından olması səbəbi ilə ölüm şərbətini içirdi, çoxlu ordu və saysız qoşun toplayıb, Gürcüstan valisi Küstəndil[409] və Şəki [hakimi] Əmir Seydi Əhmədlə ittifaq halında Qara Yusifə qarşı müxaliflik kəmərini belinə bağlayaraq döyüş və vuruş meydanına yönəldi.

O tərəfdən Qara Yusif Türkman çoxlu qoşunlarla uğur və səadətlə Şənbi-Qazana yollandı. O, Əmir Qaramanı atəş yağdıran oxun ucu ilə dağı deşən, Cövza (Əkizlər) bürcünün kəmərbəndini göy günbəzin (səmanın) qübbəsinə tikən və can alan nizənin ucu ilə ayın üzündəki ləkələri təmizləyən,

Nəzm

"Birlikdə qaldırdıqları tozları bulud, açılmış oxları yağış,

---

[404] Bəm – Kirmandan cənub-şərqdə, Kuhbəndan silsiləsinin cənub yamaclarında yerləşən şəhər. Gərmsirat (gərmsir) – isti iqlimə malik yer deməkdir. İranda (İran körfəzi sahillərində) və Əfqanıstanda (Hirmənd çayı boyunda) bu adda coğrafi məkanlar da vardır.

[405] Sircan – Kirmandan cənub-qərbdə şəhər.

[406] Xərac – orta əsrlərdə islam ölkələrində müsəlman əhalidən alınan əsas torpaq vergisi idi. Lakin XV əsrdən xərac əvəzinə torpaq vergisi kimi malcəhət (mal u cihat) terminindən istifadə olunmağa başlandı. Bir çox hallarda Səfəvi mənbələrində xərac adı altında ümumiyyətlə vergi nəzərdə tutulur *(А.А.Али-заде. Социально-экономическая и политическая история Азербайджана, с.210-216; Эфендиев О.А. Образование азербайджанского государства Сефевидов, с.41)*.

[407] Xızır xan – Dehli sultanı (1414-1421). Dehli sultanı olmazdan öncə Moltan hakimi idi *(E.Konukçu. Hızır Han // TDVİA, cilt: 17, yıl: 1998, s.415-416)*. Yəqin ki, o, Şahruxa Moltan hakimi olduğu zaman elçilik göndərmişdir.

[408] Moltan (Multan) – Pakistanın Pəncab vilayətində şəhər.

[409] Küstəndil – gürcü hökmdarı I Konstantin (1407-1412).

Qılınclarının şüası ildırım və koslarının[410] hay-küyü göy gurultusu olan"
bahadırlarla və öz adamları cümləsindən olan miraxurlarla birlikdə mənqəlay [təyin] etdi. Qara Yusif, Baba Hacı bəy Gavərudiyə Ərdəbili mühafizə etməyi tapşırdı.

Şeyx İbrahim Kür çayı kənarında düşərgə qurub öz ətrafında xəndək qazdırdı. Qara Yusifin ordusu çaydan külək kimi keçib müxaliflərə həmlə etdi[411]. Əmir Qaraman və Əmir Bistam tam qələbəliklə müxaliflərin çadırları arasına girdilər. Şirvanlılar döyüşə və vuruşa başladılar. Bahadırların nərəsi, qazilərin[412] təkbir ("Allahu-əkbər") və təhlil ("La ilahə illəllah") nidası, şirvanlıların və gürcülərin bağırtısı fələklər fələyinin qulağını kar etdi və hərbi kosun avazı ilə döyüş neyinin sədası dağa zəlzələ və o şövkətsiz güruha vəlvələ saldı. Qara Yusifin ordusunu seyr edən Sultan İbrahim düşüncəsiz hərəkətindən peşman oldu. Çünki qarşısında izdihamlı qoşunlardan və şövkətli güruhdan ibarət coşqun bir dərya görmüşdü. Atların kişnərtisindən və igidlərin qışqırığından havaya hay-küy düşmüşdü. Küstəndil bir dəstə rəzillə ad-san [qazanmaq] üçün savaş meydanına qədəm qoydu. Onlar fədakarlıq göstərdilər və inadkarlıq kəmərini bellərinə bağlayıb doğru dinin nurunu söndürməyə səy göstərdilər[413]. Döyüş meydanının səthi igidlərin və atların əzalarından görünməz oldu. Nilufər rəngli xəncərin üzü gürcülərin çöhrəsində zəfəran rənginə boyandı. Daş kimi ağır gürz dəbilqəni və başı birlikdə əzdi.

Nəzm

"Zəfər axtaranlar atəşin üstündəki civə kimi titrəməyə başladılar,
Cahan yanar oldu gizlin, dəmir ürəklərdəki atəş kimi.
Dil damaqda susuz qalmış, atəş üstündəki nal kimi,
Dəbilqənin altındakı igidlər həvəngdəki sürmə kimi idilər.
Zirehin dar halqasından qan fışqırmağa başladı,
Elə bil ki, atəş suyu süzülür ələk kimi.
Qan içənlərin nizələri sinələri fəqir-füqəranın sinəsi kimi deşir,
Döyüşçülərin qılıncının ucu yuxu və badə kimi igidləri yıxırdı.
Oynadı igidlərin gözü zər kimi öz kasasından,
Nərd büsatı oldu meydan və nərd daşı oldu igidlərin bədəni".

Şirvanlılar və gürcülər Qara Yusif Türkmanın bayrağının aslanının qorxusundan tülkü kimi arxalarını çevirib qaçmağa başladılar və hökmdarın Hümaya[414] bənzər çətirinin əzəmətindən dələ kimi hər tərəfə dağılışdılar. Onlar öz çeşidli mallarını və növbənöv nəfis əşyalarını yerə atıb qaçmışdılar. Belə ki, döyüş meydanı qızıl əşyalar, gümüş qablar və çadırlarla dolu idi.

Nəzm

"Əlvan paltarın əksindən hava İrəm bağı kimi,
Yer yaqut yığınından nar gülü kimi qırmızı.
Müşk vəzisinin və kafur qoxusunun çoxluğundan,
Olmuş səba yeli əttar[415] dükanı kimi".

Qara Yusifin ordusu gürcüləri də mühasirəyə alıb, kəsici qılınc və can alan nizə zərbəsi ilə o pis inanclıların əksərini həlak torpağı üzərinə salaraq Küstəndili əsir etdi. Sultan İbrahim xəndəyə yıxıldı və əli sındı. Bu əsnada bir türkman ona yetişdi. Əlinin ağrısının şiddətindən özünü ona göstərdi. O şəxs onun boynuna bir örtük salıb onu Qara Yusifin hüzuruna gətirdi. Onun adlı-sanlı oğullarından və ali mənşəli əmirlərindən Qəzənfər, Əsədulla, Xəlilulla, Mənuçöhr, Əbdürrəhman, Nəsrulla, Haşım, Qazı Padar və Əmir Hu-

---

[410] Kos – iri bir zərb aləti olub, əsasən hərbi yürüşlərdə istifadə olunardı *(A.Nəcəfzadə. Azərbaycan çalğı alətlərinin izahlı lüğəti, s.107-108).*

[411] Başqa mənbələrə görə, bu döyüş h. 816-cı ldə deyil, h. 815-ci ilin ramazan ayının ortasında (19.12.1412) baş vermişdir *(F.Sümer. Kara Koyunlular: Başlangıçtan Cihan-Şah'a kadar. Ankara, 1992, s.92).*

[412] Qazi (ğazi) – din yolunda müharibə edib qalib gələn döyüşçü.

[413] Burada "Qurani-Kərim"in "Tövbə" surəsinin 32-ci ayəsinə və ya "Səf" surəsinin 8-ci ayəsinə işarə edilmişdir: "Onlar Allahın nurunu öz ağızları ilə söndürmək istərlər".

[414] Hüma – Şərq mifologiyasında və divan ədəbiyyatında üstün xüsusiyyətləri ilə yer alan əfsanəvi quş *(C.Kurnaz. Hüma // TDVİA, cilt: 18, yıl: 1998, s.478).*

[415] Əttar – dərman maddələri, ədviyyat, ətriyyat və müxtəlif bitki yağları hazırlayan və satan adam. Burada "əttar dükanı" deyildikdə ətriyyat dükanı nəzərdə tutulur.

şəng əsir edildilər. Şirvanlılar savaşda süstlük göstərdikləri üçün Qara Yusif onlara pis davranmadı. Gürcü məhbuslarının isə hamısını qətlə yetirdi. Küstəndilin boynunu Pirbudaq öz əli ilə vurdu. Sultan İbrahimi isə həbs edib Təbrizə apardı.

Bir gün Sultan İbrahim əlinin ağrısından şikayət etdi. Sultan Pirbudağın atabəyi olan və Sultan İbrahimi nəzarət altına saxlayan Əmir Qara [bunu Qara Yusifə] ərz etdi. Qara Yusif onu çağırdı. Şirvan valisi türkman hökmdarının yanına gəldikdə yaraşıqlı cavanlar və gözəl hüsn-camal sahibləri buyruğa əsasən əllərində kasa ilə onu qarşıladılar. Sultan İbrahim qorxusuz-hürküsüz surətdə elə ürək oxşayan kəlmələr dilə gətirdi ki, Qara Yusif ona valeh oldu. Bu əsnada Əxi Qəssab dedi:

- Sultan İbrahim divan naiblərinin hansı şərtlərini qəbul etmişsə, biz onu ödəməyə zamin oluruq.

Qara Yusif, Əxi Qəssabın sözünü qəbul etdi. Axırda [Qara Yusif, Sultan İbrahimin] nəcib əxlaqı və səmimi peşmançılığını nəzərə alıb onun xoşagəlməz hərəkətlərini bağışladı və ayağından bəndi açdırıb ona öz yanında yer verdi. Sultan İbrahim min iki yüz İraq tüməni [ödəməyi] qəbul etdi və bunu dövlət xəzinəsinə göndərəcəyini bildirdi. Həmin qışda o, Qara Yusifin hüzurunda qalıb, baharda Şirvana yola düşdü.

### Şahrux padşahın Bədəxşana qoşun göndərməsi

Bu il Şahrux mirzə, İbrahim sultanı, Əmir Mizrabı, Əmir Firuzşah Tərxanı və Əmir Əli Türkmanı bir dəstə bahadırla Bədəxşanı zəbt etməyə göndərdi. Yüksək şanlı əmirlər Bəğlandan keçib Kəşm[416] şəhərində dayandılar.

O diyarın valisi Şah Bəhaəddin qohumları və yaxınları ilə sərt dağlara və qalın meşələrə sığındı. Əmirlər ləl mədənindən (kani-ləl) keçib, Ceyhun çayının mənbəyi olan şəhərin yaxınlığında dayandılar. Əmirlər o diyarın idarəçiliyini Şah Bəhaəddinin qardaşı Şah Mahmuda verib Herata qayıtdılar[417].

### Şahrux padşahın Xarəzmə qoşun göndərməsi

Bu il Şahrux padşah, Əmir Əleykə Kükəltaşı və İlyas Xocanı çoxlu qoşunlarla Xarəzmi zəbt etməyə göndərdi. O diyarın hakimi olan Əmir Edigenin oğlu Mübarəkşah bu xəbəri eşitdikdə iztiraba düşüb, iş bacaran elçilərini əmirlərin yanına göndərərək peşkəş və savəri[418] verməyi qəbul etdi. O əsnada Seyid Əli Tərxanın və İlyas Xocanın nökərləri bir tərəfə getmişdilər. Onlar Xarəzm əhalisinin bir dəstəsini səbəbsiz yerə qətlə yetirdilər. Ona görə də şəhərlilər yağı olub söz yaydılar ki, Çingiz-oğlan bizə köməyə gəlir. Bu üzdən əmirlər qalanın ətrafından köçdülər. Xarəzmlilər onları təqib etdilər və çoxlu mallar ələ keçirdilər. Əmir Edigenin oğlu Mübarəkşah o malların əksərini onlardan aldı. Bu səbəbdən onlar ona qarşı da müxaliflik etməyə başladılar. Şahrux padşah, Əmir Şahməliki o diyarı idarə etməyə göndərdi. Şəhərlilər döyüşmədən qalanı təslim etdilər. Əmir Şahməlik orada yerləşdi.

### İraq və Farsdakı vəziyyətin təsviri və Mirzə İsgəndərin Qumu tutması

Bu il Mirzə İsgəndər, Xoca Məhəmməd Quminin yanına iş bacaran adamlar göndərib xocanın mülazimlərindən olan son dərəcə qabiliyyətli, yaraşıqlı və məlahətli bir cavanı tələb etdi. Xoca heç vəchlə razı olmadı. Ona görə də Mirzə İsgəndər ulduzların sayından daha çox olan bir ordu ilə Qum ətrafına gəldi və onun nahiyələrini ələ keçirdi. O, Giv qalasının Əli Dəməsər adlı kutvalını həbs edib Qum darvazası önünə apardı. Qum döyüşçüləri mərdanə vuruşdular və Mirzə İsgəndər bir iş görə bilmədi. Elə bu zaman Savə[419] hakimi Nəsrulla Səhrayi "hərgah Qum fəth edilsə, növbə Savəyə də çatacaq" düşüncəsi içərisində, Məhəmməd Qumi ilə arasının yaxşı olmamasına baxmayaraq, öz əmisi oğlu Kor İmadı bir miqdar qoşunla cəld yardıma göndərdi. O səbəbdən Xoca Məhəmmədin qüvvəti və şövkəti artmış oldu. Mirzə İsgəndər Qum ətrafından qalxdı və İsfahana getmək istədi. Xocanın etibarlı adamı olan Müzəffər Fərahani, Mirzə İsgəndərin hüzuruna

[416] Bəğlan – Əfqanıstanın şimalında, Qunduzdan cənubdadır. Kəşm (Kişm) – Əfqanıstanın şimal-şərqində, Bədəxşan vilayətindədir.
[417] Bu abzas son Tehran nəşrində yoxdur.
[418] Peşkəş və savəri – rəiyyətin tabe olduğu feodala və ya hökmdara, həmçinin vassalın öz ağasına itaət əlaməti olaraq hədiyyələr təqdim etməsi öhdəliyini özündə ehtiva edən vergi növüdür.
[419] Savə – İranda, Həmədanla Rey arasında yerləşən şəhər.

bir məktub göndərdi və ona xəbər verdi ki, "əgər Qumun idarəçiliyini mənə versəniz və bunu öz əhdiniz və andınızla təsdiq etsəniz, şəhəri [sizə] təslim edərəm". Elə ki aralıqda əhd-peyman bağlandı, o nankor məkr və hiyləyə başladı. O, Xoca Məhəmmədi razı saldı ki, əksəriyyəti qalada olan Qum əhalisini mühafizə üçün şəhərə göndərsin və beləliklə, camaatı şəhərdə pərən-pərən saldı. Özü isə say-seçmə adamlar və xocanın qardaşı oğlu Əmir Mahmudla mühafizə üçün şəhərdə oturub hər yerdə bir bəhanə ilə Əmir Mahmudun mülazimlərini qoydu. Belə ki, Əmir Mahmudun yanında beş-altı nəfərdən artıq adam qalmadı. Bu zaman o, Kəngan darvazasından çıxıb Əmir Mahmudu tutdu. Mirzə İsgəndərin qoşununun bir dəstəsi nankor Müzəffərin məsləhəti ilə həmin darvazanın bayırında yerləşən Xoca Əli Səfi xanəgahında[420] məskən salmışdı. Onlar məkr pusqusundan çıxıb onu İsfahana apardılar və xocanı qardaşı oğlu ilə birlikdə qətlə yetirdilər. Qumun idarəçiliyi Abdulla Pərvanəçiyə[421] həvalə edildi və razılaşmaya əsasən, malların idarəsi (vergilərin toplanması) Müzəffərə tapşırıldı. Mirzə İsgəndər bu il İsfahanı paytaxt etdi. İsfahanda bir başqa səfa peyda oldu.

### İran padşahı Qara Yusif Türkmanın əhvalının təsviri

Bu il Qara Yusif Türkman Diyarbəkr tərəfə getdi və Pirbudaq üçün şahanə bir toy və padşahlara layiq bir ziyafət tərtib etdi. Pirbudaq xan yaxınlarından və xüsusi adamlarından ibarət bir dəstə ilə məclisdə oturub fərəh və sevinc qapılarını açdı. Xoş ahəngli mütrüblərdən ud və çəng nəğməsi yüksəldi. Ay üzlü saqi[422] əqiq rəngli saf şərab qədəhini payladı və şərab piyaləsini günəşin zərli camı kimi dolaşdırdı. Belə ki, min qoyun və yüz madyan kəsildi. Digər ləvazimatı da bununla müqayisə etmək gərək. Türkman əmirlərinə və Azərbaycan əyanlarına şöhrətli atlar və zərnigar kürklər hədiyyə etdi. Ondan sonra hərəkət bayrağını Bitlis tərəfə qaldırdı. O diyarın hakimi Əmir Şəmsəddin qohum-əqrəbası ilə birlikdə xidmətkarlıq və fədakarlıq şərtlərini yerinə yetirdi. Qara Yusif, Tərcanın idarəçiliyini Qara Bahadıra həvalə edib sədd kimi əsgərlərlə oradan Həmidə[423] yönəldi. Yol əsnasında Cermük[424] qalasını ələ keçirib onların əksər adamlarını qətlə yetirdi. Ondan sonra Qəni (Erqani)[425] qalasına yönəldi. Qara Osman da onu qarşılamağa çıxıb, çoxlu döyüşdən sonra məğlub olaraq qalaya sığındı. Qara Yusif oradan geri dönüb, Əmir Bistamın müxalifliyi səbəbindən İraqa yönəldi. Sultaniyyəni xarab edib, rəcəb [ayının] 20-də (16.10.1413) Təbriz şəhərinə gəldi.

### Müxtəlif əhvalatlar

Bu il Day Ming xanın yanından Herata elçilər gəldilər və Zağan bağında[426] Şahrux padşahın hüzuruna çıxmaq şərəfi ilə baş ucalığı qazandılar. O həzrət Şeyx Məhəmməd Bəxşini onlarla birlikdə Xətaya göndərdi.

Həmçinin bu il Qara Yusif Türkman Təbrizdən Qəzvinə gəldi və oradan Həmədana yönəldi. Mirzə İsgəndər bəla əlamətli ordu ilə onu qarşıladı və ordusunun ətrafında xəndək qazdırdı. Qara Yusifin ordusu göründü. Mirzə İsgəndərin qoşunu çox qorxdu. O əsnada Qara Yusifi ağır bir xəstəlik tutdu və Azərbaycana tərəf qayıtdı. Elə ki Gavəruda çatdı, o diyarın hakimi Baba Hacı bəy onun hüzuruna gəlib tam hörmətlə qarşılandı. Ondan sonra Qara Yusif Təbrizə yollandı. Cəmadiyülaxır ayının 10-da (07.09.1413) o şəhərə daxil oldu.

Həmçinin bu il Şahrux padşah Azərbaycana yürüş iradəsi ilə Heratdan Nişapura[427] gəldi. Oradan İsgəndərə bir məktub yazdı. Məzmunu belə idi: "Ali bayraqlarımız Qara Yusif Türkmanı dəf etmək üçün Azərbaycana doğru hərəkət etməkdədir. Ey oğul, gərəkdir ki, sən də türkman ordusunun şövkətini qırmaq və bu xanədanın məmləkətinin düşmənlərini dəf etmək üçün səy göstərib çalışasan, heç bir bəhanə və üzrxahlıq-

[420] Xanəgah, təykə, zaviyə – bir şeyx və ya mürşidin rəhbərliyi altında olan dərvişlərin yaşadıqları və ibadət etdikləri yer, sufi təriqətlərinin məkanı.
[421] Pərvanəçi – sarayda fərman yazmaq işi ilə məşğul olan məmur.
[422] Saqi – su verən, su paylayan və satan; içki məclisində şərab paylayan.
[423] Həmid (Amid) – Türkiyənin Diyarbəkr şəhəri nəzərdə tutulur.
[424] Cermük (Çermik) – Diyarbəkrdən şimal-qərbdə, Erqanidən cənub-qərbdə yerləşir.
[425] Erqani – Diyarbəkr şəhərindən şimal-qərbdə, Elazığ və Diyarbəkr şəhərləri arasında yerləşir.
[426] Zağan bağı (Qarğalar bağı) – Heratın qala divarlarının şimal-qərb bucağının xaricində yerləşirdi *(Seddon, şərhlər, s.254).*
[427] Nişapur – İranın şimal-şərqində, Xorasan vilayətində, Məşhəd və Səbzəvar şəhərləri arasında yerləşən şəhər.

la özünü bizə kömək göstərmək yolundan çəkindirməyəsən, Fars və İraq qoşunlarını cəmləyib, Rey nahiyəsində fələk şövkətli ordumuza qoşulasan".

Sözügedən məktubu mütaliə edən Mirzə İsgəndər elə təsəvvür etdi ki, Şahrux padşah İraqı zəbt etmək iddiasına malikdir. Ona görə də müxaliflik edərək, öz adına sikkə vurdurub xütbə oxutdu və bir dəstəni Simnana basqın etməyə, başqa bir dəstəni isə Quhistanı[428] talamağa göndərdi. Kafi İslamı yaxşı xələtlər və rəğbət doğuran atlarla[429] Qəndəhar və Sistan hakimlərinə göndərdi və onlara yolladığı məktubların başında bu ibarələri yazdı: "əl-qaim bi əmril-müslimin və vəliyyi-əmirülmöminin Sultan İsgəndər"[430].

Sistan hakimi (Məlik Qütbəddin) onun elçisini tutub Şahrux padşahın dərgahına göndərdi. O həzrət həmin qışda Mazandaranda qışlaq etdi.

Həmçinin bu il Qara Yusif Türkmanın oğlu Şah Məhəmməd Bağdaddan Şəhrizura[431] gəldi. Məhəmməd Sarı Türkman çox döyüşdükdən sonra əsir alınıb Hit qalasında[432] məhbus edildi.

Bu il Baba Hacı bəy Gavərudi əhd-peymandan sonra oğulları və qardaşları ilə Qara Yusifin dərgahına gəldi. O həzrət mürüvvətinin çoxluğu üzündən Gavərud bölgəsini altı yüz kəndlə birgə adı çəkilən şəxsə bağışladı. Hökmdarın fərmanı verildi ki, o, hökmdarın nişanlarına möhür vursun, onun razılığı olmadan dövlət ərkanı külli və cüzi işlərdən heç birini həll etməsinlər və onun qardaşı Hacı Məhəmmədə də güman etdiyindən daha artıq hörmət göstərdi.

### Ölümlər

Bu il seyid mənşəli cənab, [biliklərini] ifadə etməyin ustası, feyz bəxş edən, üləmanın ümdəsi, şərəflilərin və mütəfəkkirlərin öndəgedəni Əmir Seyid Şərif Əllamə Cürcani fani aləmdən əbədi cahana köçdü.

779-cu ildə (10.05.1377 – 29.04.1378) Məhəmməd Müzəffərin oğlu Şah Şüca Qəsri-Zərddə olarkən Əmir Seyid Şərif onun ordusunun həndəvərinə gəldi. İstədi ki, şahla görüşsün və onu heç kimin vasitəçiliyi olmadan öz halından agah etsin. O əsnada Şah Şücanın hüzuruna getməkdə olan Mövlana Səədəddin Məsud Ünsini[433] gördü. Özünü döyüşçü libasında ona göstərib dedi:

- Mən qərib və oxatan (oxçu) bir adamam. Ümidim odur ki, fürsət düşdükdə mənim xahişimi [şaha] ərz edəsən.

O, Mövlana Səəddinin üzəngisinin yanında bargahın qapısına qədər piyada getdi. Mövlana dedi:

- Burada gözlə ki, mən içəri daxil olmaq üçün izin alım.

Mövlana padşahın hüzuruna çıxmaq şərəfi ilə feyzləndikdə qərib oxatanın sözünü də ərz etdi. Şah Şüca dərhal onu çağırdı və Əmir Seyid Şərif dərgaha gəldi. Şah oxatanın halını soruşdu. O, öz şərəfli təbinin nəticəsi olan və [müxtəlif] əsərlərin müəlliflərinə qarşı etirazlarından ibarət olan bir dəftəri qoltuğundan çıxarıb Şah Şücanın əlinə verdi. Şah Şüca bu səhifələri oxuyub Mir Seyid Şərifin halından agah oldu. Ona hörmət və ehtiram göstərdi, çoxlu nağd (pul) və cins (mal) ənam verdi və o cənabı özü ilə bərabər Şiraza aparıb öz darüşşəfasının tədris mənsəbini həmin fəzilətli seyidə həvalə etdi. Əmir Seyid Şərif on il Farsda fəzilət və kamal əhlinə dərs dedi.

789-cu (1387) ildə Əmir Teymur Kürəkan Şirazı fəth etdikdə hökm buyurdu ki, o cənab Səmərqəndə təşrif aparsın. Seyidliyin pənahı olan, ifadə məharətinə və həqiqət sərvətinə malik cənab itaəti vacib olan fərmana əsasən, o şəhərə tələsib o həzrətin ölüm zamanına qədər orada qaldı. Həmin dövrdə onunla Mövlana

---

[428] Quhistan (Kuhistan) – mənası "dağlıq ölkə" demək olub, Xorasan vilayətinin bir bölgəsi idi; Məşhəddən cənubdakı əraziləri, Turşizi və onun ətraf yerlərini əhatə edirdi *(Seddon, şərhlər, s.249)*.

[429] Mənbənin Nuruosmaniyyə və Paris nüsxələrində müvafiq surətdə "əsbab" və "əsbabha" (mallar) yazılmışdır. Lakin Ə.Nəvai (s.204) "Mətləüs-səadeyn"ə əsasən, bu ifadəni əsbha (atlar) kimi təshih etmişdir.

[430] Ə.Nəvai *(Şərhlər, s.205)* hesab edir ki, "vəliyyi-əmirülmöminin" ifadəsi İsgəndərin müstəqil bir padşah olaraq Misirdəki Abbasi xəlifəsinə beyət etdiyini və ya beyət etmək istədiyini göstərir.

[431] Şəhrizur – müasir İran – İraq sərhədi yaxınlığında, İraqın Süleymaniyyə şəhərindən cənub-şərq istiqamətdə, Diyala çayı vadisində yerləşən qədim şəhər.

[432] Hit qalası – Bağdadın şimalında, Fərat çayı sahilində yerləşirdi *(F.Sümer. Kara Koyunlular, s.64)*.

[433] Bu şəxs, Şah Şücanın Məlik İzzəddin Lurun qızı ilə kəbinini kəsmiş, bundan əlavə, Şah Şücanın ərəbcə və farsca nəzm və nəsr əsərlərindən ibarət divanını tərtib etmişdir *(Nəvai, şərhlər, s.206)*.

Sədəddin Təftazani[434] arasında mübahisələr baş verdi və əksər məclislərdə Əmir Seyid Şərif təbinin hiddəti və zehninin zənginliyi səbəbindən cənab Mövlanaya qələbə çaldı.

Nəzm

"Yüksəyi və alçağı yaradan Tanrı,
Hər əldən üstün olan bir əl yaratmışdır".

Əmir Teymur Kürəkan əbədi cahana köçdükdən sonra o Xeyrülbəşər[435] övladlarının öndəgedəni və bilikli alimlərin rəhbəri yenidən Mavəraünnəhrdən Şiraza tələsdi. Şərəfli ömrünün müddəti yetmiş altı il olmuşdur. Əsərləri sırasında bunlar vardır: kəlam elmi haqqında "Şərhi-müvafiq" ("Müvafiq şərh"), "Haşiyə bər şərhi-təcridi-qədim" ("Qədim təcrid şərhinə dair haşiyə"), "Şərhi-kafiyə" ("Kifayətedici şərh"), "Haşiyə bər şərhi-mətale" ("Mətlələr şərhinə dair haşiyə"), "Haşiyə bər şərhi-təvale" ("Talelər şərhinə dair haşiyə"), "Haşiyə bər şərhi-şəmsiyyə" ("Şəmsiyyə şərhinə dair haşiyə"), "Haşiyə bər təsrif" ("Təsrifə[436] dair haşiyə"), "Haşiyə bər kəşşaf" ("Kəşşafa dair haşiyə"), "Haşiyə bər mütəvəssit" ("Mütəvəssit" əsərinə dair haşiyə"), "Haşiyə bər mütəvvəl" ("Mütəvvələ dair haşiyə"), "Haşiyə bər hikmətül-eyn" ("Varlıq hikmətinə dair haşiyə"), "Haşiyə bər mühakimat" ("Mühakimələrə dair haşiyə"), "Haşiyə bər şərhi-müxtəsəri-Üzdi dər üsul" ("Üzdinin üsul haqqındakı müxtəsər şərhinə haşiyə"), Haşiyə bər şərhi-hidayeyi-Mirək Çəngi" ("Mirək Çənginin "Hidayə" əsərinin şərhinə dair haşiyə"), məntiq haqqında farsca "Sərfiyyə və kübra" risaləsi[437] və mənalar haqqında "Şərhi-miftah" ("Açarların şərhi").

## 817-Cİ İLİN (23.03.1414 – 12.03.1415) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### Mavəraünnəhr diyarında baş vermiş hadisələrin təsviri

Bu il Mirzə Uluğ bəy çoxlu qoşunlarla Əndicana[438] hərəkət etdi. O diyarın hakimi Mirzə Mirək Əhməd müqavimət göstərməyə tab gətirməyib Uratəpə dağına[439] pənah apardı. Mirzə Uluğ bəy Əxsi qalasını[440] ələ keçirib, oranın idarəçiliyini Payəndə Bukavula[441] tapşıraraq Əndican tərəfə yönəldi. O diyarın idarəçiliyi Əmir Musaka ilə Əmir Məhəmməd Tabana verildi. Səadətli şahzadə Səmərqənd tərəfə qayıtdı. Uluğ bəyin çıxıb getməsindən sonra Mirzə Mirək Əhməd Moğolustan qoşunları ilə Əndican ətrafına gəlib, Əmir Musaka və Əmir Məhəmməd Tabanla döyüşərək onları qətlə yetirdi. Qalan əmirlər Əndicanı qorudular. Moğollar o diyarı çapıb-talayıb öz diyarlarına yola düşdülər.

### Şahrux padşahın İsfahan tərəfə hərəkət etməsi və Mirzə İsgəndərin dustaq edilməsi haqqında söhbət

Bu ilin əvvəllərində yaxşı xasiyyətli padşah Şahrux Mazandarandan çıxıb hərəkət bayrağını İsfahan tərəfə qaldırdı. Öz çoxluğu ilə çölü və dağı təngə gətirən bir ordu və can alan oxlarının ucu ilə səmadakı Cövza düyününü açan və qartal qanadlı oxları ilə asimandakı Nəsreyn ulduzlarını yerə salan, pələng yıxan, aslan ovlayan adlı-sanlı cavanlarla köçə-köçə yola düşdü.

Nəzm

---

[434] Sədəddin Məsud ibn Ömər Təftəzani (1322-1389) – Nisa bölgəsinin Təftəzan adlı yerində doğulmuş din alimidir *(Öztürk, şərhlər, s.104)*.

[435] Xeyrülbəşər (ərəbcə "insanların ən xeyirlisi" deməkdir) – Məhəmməd peyğəmbərin ləqəblərindən biri.

[436] Təsrif – qrammatikada felləri zamanlara görə dəyişdirmək *(Ərəb və fars sözləri lüğəti. Redaksiya heyəti: B.T.Abdullyev, Ə.Ə.Orucov, Y.Z.Şirvani. Bakı, 1985, s.631)*.

[437] Risalə - kitabça, traktat.

[438] Əndican – indiki Özbəkistan Respublikasının şərq qurtaracağında, Fərqanə vadisinin cənub-şərq hissəsində, Əndicançay sahilində şəhər.

[439] Uratəpə - indiki Tacikistan Respublikasının Soqd vilayətindədir.

[440] Əxsi (Axsi) – indiki Özbəkistanın şərqində, Fərqanə vadisində, Nəmənqan şəhərindən cənub-qərb tərəfdə, Kasançayın Sırdəryaya töküldüyü yerin yaxınlığında tarixi şəhər.

[441] Tarixi ədəbiyyatda bukavul barədə mövcud olan mülahizələr onun şənlik təşkilatçısı, süfrəyə və xörəyin dadına baxan, saqi və s. olduğunu göstərir. Lakin XIII-XIV əsr mənbələrinin məlumatlarından göründüyü kimi, həmin zaman bukavullar ordu hissələrində yüksək mövqe tutmuşlar. Onlar ordunun quruluşu və effektli fəaliyyəti üçün dəqiq tədbirlər görməli, baş divandan ordu üçün ayrılmış təxsisatı almalı, qənimətləri ordu hissələri arasında ədalətlə bölməli, orduda nizam-intizamın möhkəmlənməsinə çalışmalı idilər *(V.Z.Piriyev. Azərbaycan XIII-XIV əsrlərdə, s.323-324)*. Səfəvilərin dövlət quruluşunu əks etdirən "Təzkirətül-müluk"da bukavul terminə rast gəlmirik. Bəzi Səfəvi qaynaqlarında bukavul termini birinci mənada, yəni saray təşrifat məmuru, eşikağasının sinonimi kimi işlədilmişdir.

“Hamısı gözəllərin qaşları kimi kaman çəkən,
Qəlblərə eşq kimi atəş vuran.
Hamısı daş kimi adam yıxan və qan tökən,
Hamısı türklərin gözü kimi fitnə salan.
Hamısı yandırıcı atəş kimi ürək odlayan,
Hamısı dilbərin qəmzəsi kimi ciyər deşən.
Aşiqin dilbərdən ötrü axıdılan göz yaşı kimi,
Cahanı bürüyən, qanlı və dilavərdir hamısı”.

Bu möhnətli xəbər Mirzə İsgəndərə çatdıqda, Əmir Yusif Cəlili, Əmir Çolbanşahı, Əmir Abdulla Pərvanəçini və Əmir Bəyan Quçini[442] şücaətli bahadırlardan ibarət bir dəstə ilə Savədə yerləşən və ona qarşı müxaliflik naxışını öz xəyal lövhəsinə çəkmiş olan Nəsrulla Səhrayini dəf etməyə göndərdi.

Bu xəbər Həzrət Şahruxa çatdıqda, Əmir Həsən Sufi Tərxanı, Əmir Dövlət Xocanı, Əmir Çaharşənbəni və Əmir Seyid Əli Tərxanı on min cavanla Savə əhalisinin köməyinə getməyə təyin etdi. Mirzə İsgəndərin əmirləri ondan üz döndərib, aləmin pənahı olan dərgaha yönəldilər və Şəhriyar qalası ətrafında qələbə şüarlı orduya qoşularaq böyük lütfkarlıqla qarşılandılar.

İsfahanın ətrafı cahan hökmdarının gəlişinin təntənəsindən cənnət bağının bir nişanəsinə çevrildikdə, bir dəstə döyüşçü aləmin pənahı olan dərgaha gəlib ərz etdilər ki, “bizim evlərimiz İsfahan darvazasının bayırındadır və əgər o həzrət (Şahrux) bizim köməyimizə bir dəstə [əsgər] göndərsə, onda [şəhərə] hakim olacaqdır”. Fərmana əsasən, Əmir Mizrab Bahadır və Əmir Xoca o tərəfə yollandılar. Mirzə İsgəndərin qaravulları şəhərdən çıxıb döyüşə və vuruşa başladılar. Bu tərəfdən Mirzə Bayqara, Lütfulla, Təvəkkül Bavərçi, Əmir Şeyx Əli və Əmir Çolbanşah Barlas o müqayisəyəgəlməz qoşunu yerindən dəbərdib darvazaya qədər qovdular və döyüşçülərin ailələrini və köçlərini hökmdarın ordusuna gətirdilər. Səf yaran bahadırların bu həmləsindən Mirzə İsgəndərin qəlbinə tamamilə qorxu hakim kəsildi. O, etdiklərindən peşman və törətdiklərindən pərişan oldu.

Ertəsi gün o, naçar şəkildə ata minib Şahrux padşahın qarşısında səf çəkdi. Elə ki gözü o həzrətin bayrağına sataşdı, özündə ona qarşı müqavimət gücünün olmadığını başa düşdü. Çarəsizlik üzündən qaçış vadisinə tələsdi. Qalib qoşun (çərik) o məğrur güruhdan çoxlarını gedər-gəlməzə göndərdi. Az qaldı ki, Mirzə İsgəndər əsir alınsın. Lakin o, min hiylə ilə özünü şəhərə saldı və tısbağa kimi başını o möhkəm qalanın içinə çəkdi. Qalanın dörd divarını özünə sığınacaq, daldalanacaq, qorunacaq yer və pənahgah etdi. Sərçə kimi əzab qəfəsinin əsiri və bəla tələsinin dustağı oldu. Göyərçin kimi möhnət tələsinə və iztirab toruna düşdü və bu beytlərin məzmunundan xəbərsiz oldu:

Nəzm

“Quş bostandan qəfəsə gələrsə,
Gərək uçmağa olan həvəsindən əl çəksin.
Bir aslan ki, zəncirə bağlanarsa,
Cüyür və ceyran ovlamaqdan qalar”.

[Dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin padşahı İsfahanın ətrafına tələsib bargahının qübbəsini günəşin və ayın zirvəsinə ucaltdı. O zaman Şəhriyar qalasından Əmir Bistamın oğlu Bayəzid dərgaha gəldi və [hökmdarın] hüzuruna çıxmaq şərəfinə nail oldu. O əsnada üç yüz nəfər yaxşı silahlanmış süvari döyüş iradəsi ilə qalanın içindən çıxdı. İlyas Xoca onları məğlub edib əksərini qətlə yetirdi. Amma özü də yaralandı. Ali mənşəli hökmdarın fərmanı ilə İsfahan divarlarını kəndirlə ölçüb onları əmirlərin arasında bölüşdürdülər. Sibələr[443] (döyüş mövqeləri) düzəldib, ürək deşən oxların zərbəsi və sinəni odlayan mizrağın ucu ilə müxalifləri yaralayaraq onları bürclərin və divarların üzərindən uzaqlaşdırdılar.

O əsnada Şirazın böyükləri və əyanları dostlara nəvaziş göstərən və düşmənləri yox edən hökmdarın tərəfinə keçib, Mirzə İsgəndərin adamlarını dustaq edərək xütbəyə və sikkəyə Şahruxun adı və ləqəbi ilə gö-

[442] Ə.Nəvai *(Şərhlər, s.209)* Bəyan Quçinin h. 809-cu ildə Mirzə Əbu-Bəkr tərəfindən öldürüldüyünü yazmış və “Mətləüs-səadeyn”ə əsasən, bu yürüşə qatılan əmirlərin adlarını belə sıralamışdır: Əmir Yusif Cəlil, Əmir Çolbanşah, Əmir Abdulla Pərvanəçi və Səədulla.

[443] Sibə – səngər; qalanı və ya şəhəri mühasirə etmiş qoşunun tutduğu mövqelər.

zəllik və zinət verdilər və bu muştuluğu çatdırmaq üçün ali taxtın ətəyinə elçi göndərdilər. O həzrət, Əmir Həsən Sufini və Əmir Çolbanşah Barlası Mirzə İsgəndərin oğullarını gətirmək üçün Şiraza yolladı.

İsfahan qalasının əhalisi hər gün [qaladan] çıxıb şiddətli döyüşlər aparırdılar. O əsnada Şahrux padşah, Qiyasəddin Qazı Simnanini elçi sifəti ilə şəhərə göndərdi və sülhdən söz açdı. Mirzə İsgəndər qəbul etmədi. Amma bir neçə gündən sonra Əmir Təvəkkül Qutğunu iki-üç atla o həzrətin hüzuruna göndərib xəbər verdi ki, "həzrət (Şahrux) geri dönsün və ondan sonra mən qorxusuz-hürküsüz onun dərgahına tələsim".

Şahrux padşah dedi ki, "əgər o, mənim hüzuruma gəlsə, onu əziz tutaram və əgər digər bir tərəfə getsə, onu narahat etmərəm". Lakin o, bu sözə də razı olmadı.

İsfahanın mühasirəsi əyyamı iki ay sürdü. Cəmadiyüləvvəl [ayının] 2-də (20.07.1414) hər tərəfdən savaşa atıldılar. O gün səhərdən axşama kimi döyüş və vuruş atəşi son dərəcə alovlandı və şöləndi. Qalibiyyətli ordu nərdivanlar hazırlayıb qalanın üzərinə hücum çəkdi. Küngürəsinin[444] başı Süreyyadan uca və xəndəyinin dibi yerin nəm çəkmiş dərinliyindən alçaq olan qala divarının üstünə asanlıqla çıxıb müxalifləri pərən-pərən saldılar və qala divarları üzərində məşəllər yandırdılar. Bu əsnada Əmir Əbdüssəməd qaçıb Şahrux padşahın hüzuruna gəldi.

Mirzə İsgəndər bu xəbəri eşitdikdən sonra can qorxusundan İsfahanı atıb, fərar yolunu tutaraq biyaban guşəsindən keçməklə aradan çıxdı. Qalib qoşunun bir dəstəsi o məğlubu tutub, aləmin pənahı olan dərgaha gətirdi. Hərçənd ondan söz soruşsalar da, cavab vermədi. O həzrət onu qardaşı Mirzə Rüstəmə tapşırdı. Amma Mirzə Rüstəm mürüvvətsizlik torpağını insaniyyət gözünə töküb qardaşının [gözlərinə] mil çəkdi.

O həzrət (Şahrux) İsfahan hakimliyini Mirzə Rüstəmə, Həmədan vilayətini Mirzə Bayqaraya və Qumu Mirzə Səəd Vəqqasa həvalə etdi. Daha sonra qələbəni elan edən bayraqlar Şiraz tərəfə hərəkətə gəldilər. [Şahrux] o diyarın idarəçiliyini də İbrahim sultana tapşırıb Herat tərəfə qayıtdı.

### Müxtəlif əhvalatlar

Bu il Şahrux padşah İmam Rzanın müqəddəs Məşhədini (Məşhədi-müqəddəseyi-Rizəviyyə), Nisanı, Əbivərdi (Bavərd)[445] və bütün Mazandaranı Mirzə Baysunqura verdi.

Həmçinin bu il Qara Yusif Türkmanın qasidi Şahrux sultanın dərgahına gəlib, onun dövlətsevərlik (sədaqət) yolu ilə getdiyini göstərən bir məktub gətirdi.

Həmçinin bu il Qara Yusif Türkmanın böyük əmirlərindən sayılan və tiyul[446] şəklində Sultaniyyə, Ərdəbil və Muğan ölkəsinə malik olan Əmir Bistam Cagirlü, Şahrux padşahın dərgahına gəlib, tam ehtirama layiq görülərək öz diyarına geri döndü.

Həmçinin Məlik Kəyumərs Rüstəmdari çoxlu peşkəşlə asiman ucalığındakı dərgaha gəldi.

### 818-Cİ İLİN (13.03.1415 – 29.02.1416) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

Bu il Qara Yusif Türkman öz say-seçmə və yaxın adamlarından Mərdanşahı Şahrux padşahın dərgahına göndərdi. [Mərdanşah] ağıl, uzaqgörənlik, fəhm, fərasət, təbdir gözəlliyi və danışıq səlisliyi baxımından Azərbaycan vilayətində istər seçkin adamlar, istərsə də sadə camaat arasında böyük şöhrətə malik idi.

Nəzm

"Hikmət əhlinin düşüncəsi kimi uzaqgörən,
Aqibəti düşünənlərin təbiəti kimi əmin.
İncəlikləri bilənlərin rəyi kimi sirləri açan,
Bir tədbirlə yüz qoşunu məğlub edən".

[Qara Yusif onun vasitəsilə Şahruxa] ərz etdi ki, "əgər o həzrət Sultaniyyə vilayətini mənə verərsə, o zaman dövlətsevərliyin vəzifəsi nədirsə, onu yerinə yetirərəm". Şahrux padşah, Mərdanşaha hörmət göstərib

---

[444] Qübbənin ən yüksək yeri.

[445] Nisa və Əbivərd – indiki Türkmənistanın cənubunda yerləşmiş tarixi şəhərlər. Əbivərd hal-hazırda Aşqabaddan 120 km. cənub-şərqdə, Kaaxka şəhərinin 8 km-də yerləşir. Qədim Nisa şəhərinin xarabalıqları isə Aşqabaddan qərbdə, Türkmənistanın Bagir kəndi yaxınlığında aşkar olunmuşdur *(V.F.Minorsky. "Tadhkirat al-Muluk", p.168; О.Экаев. Туркменистан и туркмены в конце XV – в первой половине XVI века /по данным «Алам ара-и Сефеви»/. Ашхабад, 1981, s.31).*

[446] Tiyul – Səfəvi dövründə geniş yayılmış şərti torpaq sahibliyi forması. Tiyul, əsasən dövlətə göstərdikləri xidmət müqabilində hərbi əyanlara verilirdi (daha ətraflı bax: *И.П.Петрушевский. Очерки, с.184-221*).

geri qayıtmasına izin verdi və [Qara Yusifə] xəbər göndərdi ki, “əgər öz oğlunu mənim hüzuruma yollasan, sənin xahişini qəbul edəcəyəm”. Bu sözdən Qara Yusifin qəzəb atəşi alovlandı. İstədi ki, Sultaniyyəyə gəlsin. Ona görə də Şahrux padşah, Əmir Cahanşah Barlası iyirmi min süvari ilə Reydə olan İlyas Xocaya köməyə göndərdi. Əmir Bistam Cagirlü türkman ordusunun qorxusundan Sultaniyyəni öz oğluna tapşırıb Quma gəldi. Mirzə Səəd Vəqqas onu tutub ali taxtın ətəyinə ərizə yolladı. Əmir Bistamın həbsi o həzrətin (Şahruxun) xoşuna gəlmədi. Ona görə də Əmirzadə Səəd Vəqqas, Əmir Bistamı özü ilə götürüb Qara Yusifin yanına getdi. Türkman hökmdarı onlara tam hörmət göstərdi və Əmir Bistamın oğlu Əxi Fərəci Quma göndərdi ki, şahzadənin hərəmini Azərbaycana gətirsin. Mirzə Səəd Vəqqasın möhtərəm hərəmi olan Mirzə Miranşahın qızı Ağabəyim onları tutub, o fitnənin səbəbkarı olan Teymur Şeyxi, Qutluq Xocanı və Şeyx Əli Zindəni qətlə yetirdi və onların başlarını Herata göndərdi.

**Mirzə Bayqaranın Şahrux padşaha qarşı müxaliflik etməsi haqqında söhbət**

Bu il Mirzə Bayqara öz qardaşı Mirzə İsgəndərin təhriki ilə könül lövhəsinə istiqlal xəyalı çəkdi. Mirzə Rüstəm bu hadisədən agah olduqda bir dəstə [qoşun] göndərdi ki, Mirzə İsgəndəri tutub İsfahana gətirsinlər. Mirzə Bayqara düşməni məhv edən bir dəstə bahadırla Şiraza doğru hərəkətə gəldi.

Mirzə İbrahim sultan zəfər nişanlı qoşunların gəlişindən xəbər tutduqda hazırlıqlı ordu və növrəstə cavanlarla Beyza nahiyələrində Mirzə Bayqaranın qarşısında səf çəkdi. Mirzə İbrahim sultan bir dəstə igidlə həmlə edib Mirzə Bayqaranın sağ və sol cinahlarını məğlub etdi. Mirzə Bayqara bir dəstə igidlə Mirzə Sultan İbrahimin [ordusunun] mərkəzinə həmlə etdi. Onlar buna tab gətirməyib fərar yolunu tutdular.

Nəzm

“Əgər ayağı yerdə olan ağac olsa belə,
Yerə yıxılar, əgər əsərsə bərk külək.
Gəminin ağırlığı dağ kimi olsa da,
Bu nəhəngi dəryanın fırtınası şövkətsiz edər”.

Mirzə Bayqara onların məğlubiyyətindən sonra, rəbiüləvvəl [ayının] (11.05-09.06.1415) axırlarında Şiraz şəhərinə daxil oldu. O əsnada Mirzə Rüstəm fitnənin xəmir mayası olan Mirzə İsgəndəri axirət aləminə göndərdi.

Elə ki bu xəbərlər kama çatmış padşahın qulağına yetişdi, Əmir Şahməliki Rey tərəfə göndərdi ki, o hüdudun əmirlərini toplayıb ali orduya gətirsin. O həzrət məşvərətdən sonra sonsuz qoşunların toplanması haqqında fərman verdi. Cəmadiyülaxir [ayının] 17-də (24.08.1415) Heratdan Şiraza doğru hərəkət etdi.

Nəzm

“Qələbəyə yoldaş olan bir qoşun yola düşdü,
[Elə bir qoşun] ki, dənizdən aya toz qaldırardı”.

Əmir Şeyx Loğman Barlas Xüttəlan, Qunduz[447] və Bağlan qoşunları ilə zəfər nişanlı orduya qoşuldu və yol əsnasında Qara Yusif Türkmanın casusunu tutub o diyarın vəziyyətini öyrəndi.

Qalib məiyyət Nişapurdan keçdikdə, Əmir Seyid Əli Kiya Amol[448] və Saridən xidmətkarlıq yolu ilə o xoşbəxtlik səmasının günəşinin dərgahına gəldi. Həmçinin Əmir Bistamın qardaşı Əmir Məsum tam qələbəliklə Ərdəbildən gəlib çatdı və Təbrizdə olan Qara Yusifin əhvalını ərz etdi. Zəfər bayraqlı hökmdar (Şahrux) dağı və səhranı qət etdikdən sonra şaban ayının 21-də (26.10.1415) böyük bir ordu ilə Şiraza çatdı. Mirzə Bayqara şəhərə sığındı. Dənizin və qurunun hökmdarı bu xəbəri eşidincə sürətli yürüş etdi.

Nəzm

“O şahın həvəsi daha da kəskinləşdi ki,
O tikandan xali etsin yolunu”.

Ramazan [ayının] 3-də (06.11.1415) çoxsaylı qoşunlarla Səadət meydanında[449] dövlət çadırını ucaltdı. Mirzə Bayqara zəfər bayraqlı hökmdarın gəlişindən sonra iztiraba düşüb bildi ki, qəflət girdabına batmış-

---

[447] Xüttəlan – Pamirdə, Vəxş və Pənc çayları arasında tarixi vilayət (indiki Tacikistandadır); Qunduz – Əfqanıstanın şimal-şərqindədir.

[448] Amol – İranın Mazandaran vilayətində şəhər.

[449] Səadət meydanı – Şirazın Səadətabad darvazası xaricində yerləşirdi *(Nəvai, şərhlər, s.217)*.

dır və ağılsızlığı ucbatından [öz səviyyəsindən] böyük işlərə girişmişdir. Hansı tərəfə nəzər salıb bəla və fəlakət buxovundan xilas olmağa çalışsa da, nicat və qurtuluş yolunun bağlı, qaçış ayağının sınıq olduğunu gördü.

Nəzm

“Haraya qaça bilər düşmən, əgər lap quş olsa belə,
Bir halda ki, sənin heybətinin qartalı tutub havanın üzünü”.

Onunla Mirzə Baysunqur arasında dostluğun əsası möhkəm olduğu üçün Əmir Əbu-Səidi göndərib şəfaət istədi. Mirzə Baysunqurun xahişi ilə o həzrət onun günahından keçdi. Əhd-peyman bağlandıqdan sonra Mirzə Bayqara ramazan [ayının] 5-də (08.11.1415) cahan hökmdarının bargahına tələsdi. O həzrət onu şahzadə Qaydunun yanına göndərdi.

Dostlara nəvaziş göstərən hökmdar Şiraz hakimliyini yenidən Mirzə İbrahim sultana verdi və Qum, Kaşan[450], Rey və Rüstəmdar[451] məmləkətinin idarəçiliyini ta Gilan[452] hüduduna qədər İlyas Xocaya lütf etdi.

O əsnada Əmir Gürgin[453] Lar[454] vilayətindən və dənizsahili bölgələrdən amal Kəbəsinin ehram yükünü bağlayıb o səadət qibləsinə getmək şərəfinə nail oldu.

Cahan hökmdarı Kirmanı tutmağa getdi. Elə ki Sircan qəsəbəsi aləm sakinlərinin sərvərinin dayanacaq yeri oldu, seyid mənşəli Əmir Şəmsəddin Əli Bəmi dərgaha gəlib qəbul etdi ki, əgər hökmdarın məiyyəti Xorasan tərəfə hərəkət edərsə, bacardığı tərzdə Sultan Üveysi hüzura gətirəcəkdir. Ona görə də o həzrət Herat tərəfə döndü.

### Müxtəlif əhvalatlar

Mirzə Bayqara Şirazda olarkən Mövlana Bərəndüqə beş yüz qızıl dinar lütf etdi və pərvanəçi bunun yalnız iki yüz dinarını ona verdi. Mövlana bu qitəni[455] dedi və şahzadənin ərzinə çatdrdı:

Nəzm

“Düşməni yox edən, dosta nəvaziş göstərən şah,
Cahanı saxlayan o cahangir.
Beş yüz altın[456] mənə verdi ənam,
Sultanın lütfü bəndəyə çoxdur.
Bunun üç yüzü qeyb olmuşdur indi,
Bəratımda iki yüz görünür indi.
Ya mən yanlış eşitmişəm,
Ya da pərvanəçi səhv edibdir.
Ya da ki, türk dilində məgər,
“Beş yüz altın” iki yüz dinardırmı?”

Mirzə Bayqara qitəni mütaliə edib buyurdu ki, ona min dinar bağışlasınlar.

Həmçinin bu il Şahrux padşah Əmir Teymurun xarab etdiyi İxtiyarəddin qalasını[457] təmir etdirdi.

### Ölümlər

Ömərşeyxin oğlu Mirzə İsgəndər güclü, qüdrətli və səxavətli bir padşah idi. Onun vilayətində seyidlər [vergidən] azad idilər. Hər il divan malından bol ənam verərdi. Ömrünün müddəti otuz iki il olmuşdur. Onun Pirəli adlı bir oğlu vardı. Mirzə Rüstəm onu qətlə yetirdi[458].

---

[450] Kaşan – İranın Qum və İsfahan şəhərləri arasında yerləşən şəhər.

[451] Rüstəmdar – Mazandaranın bir bölgəsidir. Şahrud çayı hövzəsində, Qəzvin və Amol şəhərləri arasında yerləşir.

[452] Gilan – Xəzər dənizinin cənub-qərb sahillərini əhatə edən tarixi vilayət. Biye-piş (mərkəz şəhəri Lahican) və Biye-pəs (mərkəz şəhəri Rəşt) olmaqla iki əmirlikdən ibarət idi. Qızılüzən (Sefidrud) çayı bu iki əmirlik arasında sərhəd sayılırdı *(И.П.Петрушевский. Государства Азербайджана в XV веке // ССИА, вып. I, Баку, 1949, с.210).*

[453] Farsdakı Lar bölgəsinin məhəlli əmirlərindən olan bu şəxs öz nəsəbini “Şahnamə” qəhrəmanlarından Gürgin Milada çatdırırdı. Bu sülalənin hakimiyyətinə I Şah Abbas son qoymuşdur *(Nəvai, şərhlər, s.218).*

[454] Lar – İranın cənubunda, Bəndər-Abbasdan şimal-qərb tərəfdə yerləşən şəhər.

[455] Qitə – əruz vəznində yazılan lirik şeir forması.

[456] “Beş yüz altın” – orijinalda da türkcə yazılmışdır.

[457] İxtiyarəddin qalası – Heratın şimalında yerləşən qala *(Seddon, şərhlər, s.244).*

## 819-CU İLİN (01.03.1416 – 17.02.1417) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### Kirman əhvalatlarının, bəzi zaman hadisələrinin və dövranın təbəddülatının təsviri

Kirmanın [idarəçilik] işlərini öz boynuna götürmüş Əmir Seyid Şəmsəddin Bəmi hərçənd Sultan Üveysi ali taxtın ətəyinə getməyə təşviq etsə də, məqsədinə çata bilmədi. Ona görə də Herata gəlib vəziyyətin nə yerdə olduğunu Şahruxa ərz etdi. O həzrət, Əmir İbrahim Cahanşah Barlası, Əmir Həsən Tərxanı, Əmir Yadigarşah Orlatı, Əmir Əleykə Kükəltaşı, Əmir Fərmanşeyxi, Əmir Qanaşirini, Əmir Musanı, Əmir Ağteymuru, Şah Qütbəddini və Şah İsgəndəri qırx min nəfər nizə oynadan izdihamlı süvari ilə Kirmanı fəth etməyə göndərdi. Onlar rəbiüləvvəl [ayının] (29.04-28.05.1416) əvvəllərində o şəhərin ətrafına çatdılar.

Sultan Üveys döyüş və vuruş iddiası ilə şəhərdən çıxdı. Amma o izdihamlı qoşunların qorxusundan qala divarları arxasına sığındı. Zəfərə yaxın olan əsgərlər o şəhəri üzük qaşı kimi dövrəyə aldılar.

Mühasirə əyyamı yetmiş günə çatdıqda Sultan Üveysi elə qorxu bürüdü ki, bəyaz gündüz onun gözünə zülmət gecənin zülfü kimi qara göründü. Peşmançılıq məngəsinə və məzəmmət girdabına düşüb cahan şahının dərgahına qasidlər göndərdi.

Nəzm

“Bir nəfər göndərdi cahan şahının hüzuruna ki,
Onun kəskin qılıncından aman tapsın.
Sözü bu oldu ki, sən şahsan və biz bəndəyik,
Bu bəndəliyə şadıq, nə qədər ki sağıq.
Sənin astanan bizim meracımız oldu,
Fələk etdi sənin qapının torpağını başımızın tacı”.

Ona görə də o həzrət buyurdu ki, Kirmanın ətrafından köç etsinlər. Neçə gündən sonra Sultan Üveys fələyin qulamlıq etdiyi hökmdara xidmətkarlıq ehramını bağlayıb, aləmin pənahı olan dərgaha gələrək dənizin və qurunun hökmdarının kimya kimi təsirli nəzərləri qarşısına çıxdı.

### Müxtəlif əhvalatlar

Bu il Ömərşeyxin oğlu Mirzə Mirək Əhməd Kaşğardan[459] dənizin və qurunun hökmdarının dərgahına gəldi. Bir neçə gündən sonra o, Mirzə İləngirlə[460] birlikdə müxaliflik etməyə başladı. Şahrux padşah onları mühafizə altındakı məmləkətlərdən (“məmaliki-məhrusə”) çıxardı.

Həmçinin bu il Mirzə Mirək Əhmədin Kaşğarda qoyduğu Əmir Şeyx Əli Toğay o diyarı Mirzə Uluğ bəyə təslim etdi.

Həmçinin bu il Cabbarverdi xan, Çingiz-oğlanı qovub özbək ulusuna sahib oldu[461].

Yenə də bu il Şəmi-Cahanın oğlu Nəqşi-Cahanın elçiləri Moğolustandan və Xızır xanın nümayəndələri Hindistandan bol peşkəşlə Herata gəldilər və Şahrux padşahdan hörmət görüb öz diyarlarına qayıtdılar.

## 820-Cİ İLİN (18.02.1417 – 07.02.1418) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### Şahrux padşahın Qəndəhara qoşun çəkməsi

Bu ilin əvvəllərində yaxşı əməl sahibi olan padşah çoxlu ordu ilə hərəkət bayrağını Qəndəhara tərəf qaldırdı. Şaban [ayının] 14-də (26.09.1417) səadətli hökmdar Hirmənd çayı kənarında dayandı. O məqamda Mirzə Suyurqatmış Bədəxşanın böyük əmirləri ilə zəfər nişanlı orduya qoşuldu. Sözügedən ayın 22-də

---

[458] Əmirzadə Pirəli 12 ramazan 819-cu ildə (03.11.1416) qətlə yetirilmişdir *(Nəvai, şərhlər, s.219)*.

[459] Kaşğar – qədim türk şəhəridir və hal-hazırda Çin Xalq Respublikasının qərbində, Uyğur Muxtar vilayətinin tərkibində, Kaşğar çayı sahilində yerləşir.

[460] Mirzə İləngir – Mirzə Miranşahın oğlu Mirzə Əbu-Bəkrin oğlu idi *(Nəvai, şərhlər, s.221)*.

[461] Farsdilli mənbələrdə “özbək ulusu”, “özbəklər” adı altında XV əsrdə Qızıl Orda dövləti və ya ona aid olan elementlər, cağatay adı altında isə Teymurilər dövləti nəzərdə tutulurdu. XVI əsrin əvvəllərində cağatay adı ilə yenə də Teymurilər və onların tərəfdarları, özbəklər adı ilə Şeybanilər və onların tərəfdarları ifadə edilmişdir.

(04.10.1417) qüdrətli və müzəffər hökmdar izdihamlı ordu ilə Qəndəhara gəldi və ramazan ayının 3-də (14.10.1417) Qəzneynin əyan-əşrəfi zəfərə yaxın olan padşahın ordusuna qatıldılar.

O əsnada Kabildən qasidlər gəldilər ki, Mirzə Qaydu fərar etmişdir. O həzrət mərhəmətinin mükəmməlliyi üzündən heç kəsi onun ardınca göndərmədi. O əsnada digər bir qasid gəldi və ərz etdi ki, onların ucbatından o diyarda sakinlərdən heç kim qalmamışdır.

Ona görə də o həzrət, Əmir İbrahim Cahanşahı bir dəstə qoşunla o üzüqaranı təqib etməyə göndərdi. O əsnada Həzarə əmirləri və sərdarları kama çatmış hökmdarın dərgahına külək rəftarlı atlar və yük götürən dəvələr göndərib bac[462] və xərac [ödəməyi] qəbul etdilər. Dövlətmənd padşah o qış Hirmənd çayı kənarında qışlaq etdi.

Bir gün o həzrət ov etmək arzusuna düşüb, son dərəcə əzəmətlə külək rəftarlı atına minərək seyrə çıxdı. Enişdə və yoxuşda qaçma-qovma əsnasında at başı aşağı yıxıldı. O həzrət yəhər üzərindən yerə düşdü və əli sındı. Şimşək və külək sürətli bir qasidi Herata göndərdilər və Ustad Mirəm Kəmangəri ali orduya gətirdilər ki, o sınığı bağlasın.

Ali dərəcəli hökmdar baharın əvvəllərində Mirzə Səncəri, Əmir Yadigarşah Orlatı və Əmir Firuzşahı müqayisəyəgəlməz bir qoşunla o diyarda qoyub buyurdu ki, əgər Mirzə Qaydu gəlməsə, onun ardınca gedib, onu ələ keçirərək aləmin pənahı olan dərgaha gətirsinlər. Hökmdarın məiyyəti isə Herat tərəfə qayıtdı.

### Müxtəlif əhvalatlar

Bu il Xətay və Maçin padşahı Day Ming xanın[463] elçiləri üç yüz nəfər süvari ilə birlikdə özləri ilə gətirdikləri çoxlu töhfə və hədiyyələrlə – şahinlərlə, atlaslarla, naxışlı qumaşlarla, Çin istehsalı olan əşyalarla rəbiüləvvəl ayında (18.04-17.05.1417) dərgaha gəldilər. Şahzadələr və xanlar üçün ayrıca olaraq hədiyyələr gətirmişdilər. Elçiliklərinin məqsədi bundan ibarət idi ki, rəiyyətin, camaatın və tacirlərin rahatlıqla gəlib-getmələrini təmin etmək üçün aralıqdan ayrılıq və biganəlik pərdəsi qaldırılsın. İlk dəfə ki elçilər gəlmişdilər, Seydi Əhməd Tərxan [Çin] padşahı üçün qonur bir at göndərmişdi. Naqqaşlar orada (Çində) o atın və iki tərəfdən onun yüyənini tutan iki axtaçının surətini (rəsmini) çəkmişdilər. [Elçilər həmin rəsmi də] gətirmişdilər. O həzrət (Şahrux), Ərdəşir Təvaçını elçilərlə birlikdə Xətaya göndərdi.

### Ölümlər

Bu il Seyid Əli ibn Seyid Kəmaləddin ibn Seyid Qivaməddin Mərəşi niqris (podaqra) xəstəliyindən vəfat etdi. Məmləkəti Mazandaran diyarı idi. Oğlu Seyid Mürtəza onun yerinə keçdi.

Şeyx İbrahim ibn Sultan Məhəmməd ibn Keyqubad ibn Fərruxzad ibn Hörmüz ibn Gəştasb ibn Fərruxzad ibn Fəramərz ibn Gəştasb ibn Fəridun ibn Fəramərz ibn Salar ibn Yezid ibn Mərzban ibn Hörmüz ibn Ənuşirəvan Adil bu il hərəkət bayrağını axirət tərəfə qaldırdı[464]. Oğlu Sultan Xəlil səltənətə əyləşdi. [Sultan Xəlilin] qardaşları Keyqubad, İshaq və Haşım müxaliflik etdi. O, Şahrux padşahın yardımı ilə onları dəf edib Şirvan diyarına sahib oldu. [Şeyx İbrahimin] səltənəti iyirmi beş il, ömrü yetmiş il olmuşdur. Onun vəziri Qazı Bayəzid idi.

## 821-Cİ İLİN (08.02.1418 – 27.01.1419) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

Bu il Bədəxşan şahlarının müxalifəti səbəbindən Şahrux padşah, Əmir Şeyx Loğmanı, Əmir İbrahimi, Əmir Məhəmməd Sufi Tərxanı və Əmir Firuzşah Tərxanı Mirzə Suyurqatmış ilə birlikdə Bədəxşanı fəth etməyə göndərdi. Əmirlər qoşun və məiyyətlə Kəşm şəhərinə çatdıqda, Şah Bəhaəddinin oğulları zəfərə yaxın olan əsgərlərin qorxusundan, yaxşı danışıq qabiliyyətinə malik elçilərini çoxlu mallarla əmirlərin yanına göndərib, üzrxahlıq və bağışlanmaq xahişi ilə dilə gələrək bac-xərac [verməyi] qəbul etdilər. Ona görə də əmirlər həmin ölkəni onlara verib Herat tərəfə qayıtdılar.

---

[462] Bac – ticarət yolları ilə yüklərin daşınması üçün nəzərdə tutulan, şəhər darvazalarında və ya gəmi keçidlərində alınan vergi növü. Bundan başqa, bac termini mənbələrdə bir çox hallarda xəracla yanaşı, onun sinonimi kimi də işlədilmişdir.

[463] Day Ming xan – Çin hökmdarlarının Min sülaləsindən olan Çju Di (1402-1424) nəzərdə tutulur.

[464] Şirvanşahlar özlərinin Sasani hökmdarı Ənuşirəvanın (531-579) nəslindən olduqlarını iddia edirdilər *(S.Aşurbəyli. Şirvanşahlar dövləti, s.293).* Lakin Şirvanşahların "Əhsənüt-təvarix"in bu hissəsindəki şəcərəsi natamam və qüsurludur.

Həmçinin bu il Mirzə Qaydu Kabildən və Qəzneyndən Herata gəldi. Şahrux padşah ona çox hörmət göstərdi. Bir müddət sonra o, yolunu azmış adamların təhriki ilə fərar etdi. Mirzə Baysunqur onun ardınca gedib, Evbeh[465] qəsəbəsində ona çataraq yaxaladı və Herata gətirdi. Həzrət onun ölkəsini Mirzə Suyurqatmışa lütf etdi.

Həmçinin bu il Şahrux padşah şaban [ayının] (03.09-01.10.1418) əvvəllərində yəqinlik sahibi olan övliyaların sultanı, Xorasanın bariz cah-calal taxtında oturan, cəddi Mustafadan sonra qazıların qazısı, babası Əliyyül-Mürtəzadan sonra qazilərin qazisi, cinlərin və insanların imamı Sultan Əbül-Həsən Əli ibn Musa ər-Rzanın, həqiqətən də, arzular Kəbəsi olan və səmavi mələklərin təvaf[466] etdiyi [məqbərəsini] ziyarət etmək əzmi göstərdi və özünün dərya kimi dərin xatirində qərar verdiyi tərzdə o müqəddəs şəxsiyyətin rövzəsində[467] nurları müşahidə və sirləri mütaliə etdi, niyaz və ixlas şərtlərini zühura gətirdi, üç min misqal[468] qızıldan düzəldilmiş qəndili o həzrətin günbəzinin içindən asdı, layiq olanlara və ehtiyac sahiblərinə nəzirlərin və sədəqələrin verilməsinə işarə etdi. Böyük seyidlərə, islam qazılarına, bütün say-seçmə adamlara və sadə camaata xeyli lütfkarlıq, qayğıkeşlik və hüsn-rəğbət göstərdi.

### Müxtəlif əhvalatlar

Bu il elçi sifəti ilə Xətaya getmiş Ərdəşir Təvaçı[469] çoxlu peşkəşlə Herata gəldi.

Həmçinin bu il Qara Yusif Türkmanın və Qara Osman Bayandurun daha öncə Diyarbəkrdən və Azərbaycandan gəlmiş elçilərinə səfər ayında (10.03-07.04.1418) geri dönmək icazəsi verildi.

Həmçinin bu il Büraq-oğlan[470], Uluğ bəyin dərgahına gəlib ehtiram gördü və öz diyarına qayıtdı.

Yenə bu il Mirzə Səəd Vəqqas Azərbaycanda dünyadan köçdü.

## 822-Cİ İLİN (28.01.1419 – 16.01.1420) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### Qara Osman Bayandurun Pir Ömərlə müharibəsinin təsviri

Bu il Pir Ömər cövşən geymiş bir dəstə igidlə hərəkət bayrağını Kəmax[471] qalasına doğru yüksəltdi. O zaman o diyarın valisi olan Qara Osmanın oğlu Yaqub bəy savaş əzmi ilə qaladan çıxıb, döyüşdən və vuruşdan sonra əsir tutuldu. Pir Ömər onu Təbriz tərəfə göndərdi və özü Ərzincan tərəfə döndü. Sonra Qara Yusif Türkmanın yanına yaxşı danışıq qabiliyyətinə malik qasidlər göndərib yardım istədi. Ona görə də Azərbaycan padşahı divan əmiri (əmiri-divan) Bayram bəyi, Baba Hacı bəy Gavərudini, Bayəzid bəy Ayinlünü və Əmir İlyas Hacılunu iyirmi min adlı-sanlı süvari ilə Qara Osmanı dəf etməkdə Pir Osmana kömək göstərmək üçün göndərdi. Adları çəkilən əmirlər güclü bir ordu ilə Mardin qışlağına yetişmək iradəsi ilə Aladağa çatdılar.

Pir Ömər bəy bu xəbəri eşitdikdən sonra çoxlu qoşunlarla Ərzincandan çıxıb əmirlərin yanına yollandı ki, onlarla birlikdə Qara Osmanın üzərinə getsin. O, Tərcan vilayətinə daxil olan Humək[472] mövqeyinə gəlib orada dayandı.

O zaman Qara Osman öz oğulları ilə Mehrifər[473] yaylağında idi. Onun qardaşı oğlu olan Həsənkeyf hakimi Piltən bəy onlar haqqında Qara Osmana xəbər göndərdi. Qara Osman yüksək şanlı əmirlərlə düşmənin dəfi barəsində məşvərət təşkil etdi. Əmirlərdən bəziləri belə ərz etdilər:

- Hərçənd bu gün onların əli bizə çatmaz. Amma sabahkı günün fikrini çəkmək və sabahın üzünü bu günün aynasında görmək gərəkdir. Yaxşısı budur ki, iki firqənin qarşılaşmasından və iki tərəfin üzləşməsin-

---

[465] Evbeh (və ya Obe, Oba, Uba) – Herat yaxınlığında bir kənddir *(Seddon, şərhlər, s.220).*

[466] Təvaf – müsəlmanların Kəbə evinin və digər müqəddəs məkanların ətrafında dövrə vuraraq yerinə yetirdikləri ziyarət mərasimi.

[467] Rövzə (ər. “bağça”) – müqəddəs şəxslərin məqbərələri bəzən bu adla xatırlanırlar.

[468] Paris nüsxəsi: “6 min misqal”. Misqal – 4,68 qrama bərabər çəki vahidi.

[469] Nuruosmaniyyə nüsxəsi: “Ərdəşir Tuğaçı”.

[470] Mətndə dəfələrlə təkrar edilən Büraq adını Baraq şəklində də oxumaq mümkündür.

[471] Kəmax – Ərzincandan cənub-qərbdə, Fərat çayının sol sahilində tarixi qala və yaşayış məskəni.

[472] İndiki Kiğıya bağlı Hubik kəndi *(Öztürk, şərhlər, s.121).*

[473] Qara Yülük Osman bəyin bu məşhur yaylağının harada olduğu dəqiq bilinmir. Bu yaylağın Erqani ilə Hazar gölü arasında yerləşdiyi ehtimal olunur *(Öztürk, şərhlər, s.121).*

dən öncə şücaət əhlindən ibarət bir dəstə ilə mərdliklə at çaparaq sürətli yürüş edək, qəflətən Pir Ömərin üstünə basqın edib həmlə küləyi ilə savaş atəşini alovlandıraq və düşmənlərin yığnağının xırmanını yandıraq.

Bu söz Qara Osmanın xoşuna gəldi. O, çoxsaylı əsgərlərdən və aslan ovlayan igidlərdən ibarət bir dəstə ilə sürətli bahar küləyi kimi talesizlik əhlinin üstünə yola düşdü. Səf yaran bahadırların qaraltısını uzaqdan görən Pir Ömər ata minib onları qarşılamağa çıxdı. İki qoşun qarşı-qarşıya gəldikdə, adlı-sanlı bahadırlar və yaxşı silahlanmış dilavərlər hay-küy salıb bir-birinə hücum çəkdilər. Zərnigar qalxanların şüasından döyüşçülərin gözləri qamaşdı. Zümrüd bədənli qılınc Pir Ömərin mülazimlərinin qanından qırmızı yaqut rənginə boyandı. Dörd qanadlı oxlar kaman yuvasından uçub, bahadırların kinlə dolu sinələrinə oturdu.

Nəzm

"O qarışıqlıqda kaman qarğasının ucbatından,
Kin sipərləri oldu qartalların yuvası.
Oxla kaman üzündən əcəl yarpaq açdı,
Göy qurşağından töküldü ölüm yağışı".

Şiddətli döyüşdən və vuruşdan sonra Ulu Tanrının təqdiri ilə Pir Ömər əsir tutuldu. Qara Osman onun qətlinə fərman verdi. Lakin oğulları Əli bəy, Şəmsəddin mirzə və İsgəndər mirzə qardaşları Yaqub bəyin əsirlikdə olması səbəbindən qətlə mane oldular. O əsnada Pir Ömər fürsət tapıb qaçdı. Xeyli araşdırmadan sonra o, yenidən yaxalanıb öldürüldü. Qara Osman Ərzincan vilayətinə basqın edib müzəffər və qalib şəkildə, qeyri-məhdud qənimətlərlə Kəmaxa döndü.

Pir Ömərin möhnətli [ölüm] xəbəri Səhənd yaylağında[474] Qara Yusifə çatdıqda, qan içən ordusunu intiqam üçün topladı. O əsnada xəbər gəldi ki, Şahrux padşah Xorasandan sonsuz bir ordu ilə köçə-köçə cilovunu boşlayaraq Təbrizə doğru hərəkətdədir. Ona görə də [Qara Yusif] həmin yürüşdən vaz keçib öz oğlu Əmir Əbu-Səidi o sərhədi qorumağa təyin etdi.

Bu ilin əvvəllərində Qara Yusif, Mirzə Pirbudağı bir sıra əmirlərlə birlikdə Şirvan tərəfə göndərdi. Onlar Dərbənd[475] qalasını mühasirə etsələr də, [oranı] tuta bilməyib geri qayıtdılar.

## Şahruxun Azərbaycan tərəfə qoşun çəkməsi və İran meşəsinin şiri, Turanın aslanı Qara Yusif Türkmanın vəfat etməsi haqqında söhbət[476]

Bu yürüşün səbəbi o idi ki, həzrət öz mülazimi Sədiqi elçi kimi Təbriz tərəfə göndərdi və sülhdən söz açdı. Qara Yusif Türkman isə [cavabında] pərişanedici sözlər dilə gətirdi. Sədiq Herat tərəfə qayıtdı.

Nəzm

"Çünki qasidi qüssədən yordun,
Acı zəhərlə dodağını buladın.
Tikan və qanqal kimi çox olan,
Və bədənə neştər kimi batan sözlər dedin".

O, [Şahruxa] belə məruzə etdi:

- Qara Yusif Türkman özünü o diyarda müstəqil padşah sayır və ətrafdakı hakimlər, yan-yörədəki sərdarlar ona tabedirlər. Möhkəm qalalar düzəldib və müxaliflik bayraqlarını yüksəldib. Padşahın şövkətindən və onun ordusunun qələbəliyindən əsla qorxu-hürküsü yoxdur. Onun çoxlu qoşunları var, qarşıdurma və vuruşma naxışını öz beyninin lövhəsinə həkk etmişdir.

Nəzm

"Dava üçün kəmərini möhkəmlədib,
Savaşdan başqa bir düşüncəsi yoxdur".

Elə ki o pis əməl sahibinin (Qara Yusifin) hegemonluğu gözəl xasiyyətli padşaha (Şahruxa) çatdı, onun qəzəb atəşi alovlandı.

Nəzm

"Bu dikbaşlıqdan o İsgəndər nişanlı,

[474] Cənubi Azərbaycanda, Təbriz şəhərindən cənub tərəfdə yerləşir.
[475] Dərbənd – hazırda Dağıstan Respublikasının cənub-şərqində yerləşən tarixi Azərbaycan şəhəri.
[476] Əslində bu hadisələr h. 823 / m. 1420-ci ildə baş vermişdir *(İ.Aka. Mirza Şahruh, s.115-119)*.

Ay üzlülərin kəkili kimi pərişan oldu.
O, pəri çöhrəlilərin zülfü kimi qıvrıldı,
Bədxahın su üzərinə vurduğu naxış ucbatından".

Saray əmirlərini və dərgah müqərrəblərini[477] toplayıb məşvərət təşkil etdi. Onlar dedilər:

- Bu fəsad qaynağının cismi qılınc və nizə işlətmədən kəsilməz və Azərbaycan ordusunun tüğyanı bahadırların həmləsinin sərsəri küləyindən başqa heç nə ilə yatırılmaz.

Ona görə də hökmdar hökm verdi ki, təvaçılar Xətay sərhədindən ta Azərbaycan hüduduna qədər, Qəlmaq (Kalmık) sərhədindən ta Dəşti-Qıpçağa qədər və Türküstandakı Əqsidən[478] ta Hindistanın ortasına qədər cahan qoşunlarını Azərbaycana yürüş üçün hazır etsinlər. Cəbbədarlar ərz etdilər ki, "otuz min dəst cəbbə[479] hökmdar qurxanasında[480] mövcuddur". Qərar verildi ki, daha on min [dəst] düzəltsinlər və mühafizə altındakı məmləkətlərdən ("məmaliki-məhrusə") – Kaşğardan, Türküstandan, Məvəraünnəhrdən, Xorasandan, Kabildən, Toxarıstandan[481], İraqdan, Farsdan, Xuzistandan, Təbəristandan[482], Kirmandan və Ümman (okean) sahillərindən məmləkətlərin vergiləri hesabına zəmanənin qiymətinə uyğun olaraq döyüş əsləhəsi – qılınc, nizə və xədəng oxu satın alıb hökmdarın düşərgəsinə gətirsinlər. Mirzə Uluğ bəy Məvəraünnəhri mühafizə etmək üçün o diyarda qaldı, amma o diyarın qoşunlarından on min[483] süvarini qələbə şüarlı orduya göndərdi. Qərara alındı ki, Mirzə Suyurqatmış Hindistan sərhədini qorumaq üçün Kabildə qalsın. Əmir Əhməd Tərxan isə Xorasan əyalətinə təyin olundu.

Cahan padşahı şaban [ayının] 11-də (01.09.1419) Zağan bağından çıxıb Azərbaycana doğru hərəkət etdi.

Nəzm

"Zəmanənin sahibqiranı Şahrux,
Günəş görkəmli və ay üzlü şahənşah.
Tərpəndi yerindən döyüş əzmi ilə,
Parlaq günəş kimi, bayraqla və iti qılıncla.
Ölkələr fatehinin ayağını öpmək ümidi ilə,
Yer canlanaraq oynadı yerindən".

Cahan hökmdarı Mağan gölü çəmənində dayandı. Bu yürüş elə bir vaxtda baş verirdi ki, istiliyin çoxluğundan su qaynayırdı, səmum yelindən torpaq kürəsi atəş kürəsinə dönmüşdü və hərarət alovundan havanın təbiəti cəhənnəm hərarətinə qovuşmuşdu.

Nəzm

"Günəş dəmiri əridirdi,
Torpaq isti qumla dolu bir tava idi.
Göyləri isidən o qumdan,
Ulduz noxud kimi qovruldu.
Təzə ay səmada görünmədi,
Fələk istidən dilini çıxardı.
Yağda kabab olan balıq kimi,
Timsahlar dənizdə yanmaqdan coşdular".

Havanın hərarəti və qoşunların toplanması səbəbindən bir neçə gün o məkanda qaldılar. O əsnada Əmir Şahməlik Xarəzm ordusu ilə döyüş əzmi ilə Əmir Həsən Sufi Tərxanla birlikdə mənqəlay qaydasında yola düşdü. Dünyanı fəth edən hökmdar ramazan [ayının] 4-də (24.09.1419), tərəzi bürcünün əvvəllərində Mağan gölündən köç edib məqsədinə doğru hərəkət etdi.

---

[477] Müqərrəb – ərəbcə "yaxın adam" deməkdir. Orta əsrlərdə bir sıra Şərq ölkələrində sarayda vəzifə daşıyan məsul şəxslər şaha yaxın olduqları üçün bir qayda olaraq "müqərrəb" adlandırılırdılar. Səfəvi dövlətində bu şəxslər "müqərrəbül-xaqan" və ya "müqərrəbül-həzrət" tituluna malik idilər (bax: *Mirzə Səmia. Təzkirətül-müluk, be kuşişi: S.M.Dəbirseyaqi. Tehran, 1368, s.18*).

[478] Əqsi (Axsi, Axsikət) – Sırdəryanın sağ sahilində, Özbəkistanın Nəmənqan vilayəti ərazisində şəhər.

[479] Cəbbə – yaraq-əsləhə; cəbbədar – ordunun silahlandırılmasına cavabdeh olan məmur.

[480] Qurxana – silah anbarı.

[481] Toxarıstan – indiki Özbəkistanın və Tacikistanın cənubunu və Əfqanıstanın şimalını əhatə edən tarixi vilayət.

[482] Təbəristan – İranın Mazandaran vilayətinin köhnə adı.

[483] Nuruosmaniyyə nüsxəsi: "15 min".

Nəzm

"Ordu sel kimi yola düşdü,
O dalğada dəvələr yığın-yığın".

Mavəraünnəhrdən savayı bütün ölkə ərazisinin böyüklərindən, əyan-əşrəfindən və sipahilərindən ibarət olan və tacik sərdarın başçılıq etdiyi on beş min say-seçmə süvari və piyada hazır etdilər ki, məvacib alan qoşunlarla birlikdə [hökmdarı] müşayiət etsinlər. Müzəffər bayraqlar Cam qəsəbəsindən keçib Dizbad[484] mövqeyində dayandılar və qalibiyyətli qoşun Nişapur otlağında ov etdi.

Mirzə Baysunqur cəsarətli cavanlarla qabaqcadan yola düşdü. Şəvval [ayının] 10-da (30.10.1419) Damğan[485] ətrafında cah-calalla dayandı. Əvvəllər Mazandaranda olan, əjdahaya bənzər xortumlarının dəhşəti ilə fələyin əjdahasını başını quyruğunun altında gizlətməyə məcbur edən və öz həmlələrinin qorxusu ilə asimanın aslanının pəncəsini yerə salan,

Nəzm

"Bulud rəngli, səba sürətli, fələk qüvvətli,
Dağ şəkilli, yer kimi yük götürən, zaman kimi cəld.
İmranın Musası[486] kimi düşməni qəhr edən,
Hər biri düşməni ilan kimi yerin dibinə soxan.
Biri xortumundan qiyamət dəhşəti qoparan,
Biri dişindən cəhənnəm əzabını göstərən"

bir neçə dağ görkəmli, qana susamış fil Nisa, Əbivərd, Səməlqan, Cərməğan[487], Cürcan[488] və Mazandaran qoşunları ilə birlikdə fələk şövkətli orduya qoşuldular. Simnan ətrafında Fərah, Sistan, Qəndəhar, Qəzneyn, Kabil və Quhistan qoşunları orduya qatıldılar. Bu yürüş səbəbindən cahanın üzərindən sakitlik və dinclik qalxdı. Amma inadkarlar o həzrətin qüdrətinin və zərərinin qorxusundan çəkinmədilər və qoşun toplamaqdan, silah hazırlamaqdan daşınmadılar.

Zəfər qazanmağa adət etmiş ordu şəvval [ayının] 20-də (09.11.1419) Nəmək kəndindən keçib Vəramində[489] dayandı. O məqamda Mirzə İbrahim sultan Fars qoşunları və Mirzə Rüstəm İsfahan ordusu ilə birlikdə, Əmir Qanaşirin və Əmir Çakmak isə Yəzddən və Kirmandan [gəlib] hökmdarın məiyyətinə qoşuldular. Əmir Məsum Cagirlü çoxlu qoşunla Şəhriyar qalasından [çıxıb] qələbə şüarlı orduya daxil oldu. Təvaçılar bir neçə gün orduya baxış keçirdilər və yaxşı silahlanmış iki yüz min süvari saydılar.

O tərəfdən Qara Yusif Türkmanın səltənətinin bünövrəsi dağılmağa üz qoydu və xəstəlik qoşunu onun bədəninin şəhristanını işğal etdi. Bir tərəfdən Şahrux padşah onu dəf etməyə yollanıb kin kəmərini belinə bağlamışdı və digər tərəfdən Qara Osman onun ordusuna qalib gəlmişdi. Oğlu İsfahan mirzə Adilcevazda eyş-işrətlə və əyləncə məclisi ilə məşğul olub ona köməyə gəlmədi və digər oğlu Şah Məhəmməd mirzə Bağdadda müxaliflik edib dedi ki, "atamın ağlı qalmamışdır". Bunlara baxmayaraq, o, (yəni Qara Yusif) əsla tənəzzül etmədi.

Həmin zaman İraq (İraqi-Ərəb), Həmədan, Sultaniyyə, Tarom[490] və Qəzvin vilayətləri onun hakimiyyəti altında idi. Mirzə Cahanşah Sultaniyyədə, Korkan Alpavutla Sərkan Alpavut isə Həmədanda idilər. Adamlarını göndərib [onlara] dedi:

- Cağatay ordusundan qorxmayın. Çünki mən düşməni əzən qoşunlarla o diyara gəlməkdəyəm. Gərək hüdudu qorumaq və sərhədi mühafizə etmək üçün elə səy göstərəsiniz ki, bundan daha artığını təsəvvür etmək mümkün olmasın.

Əmir Şahməlik öz tərəfindən Payəndə adlı bir mülazimi Qara Yusif Türkmanın yanına göndərib belə bir ismarış verdi:

---

484 İranda, Məşhəddən cənub-qərb tərəfdə Dizbadi-Bala (Yuxarı Dizbad) və Dizbadi-Payin (Aşağı Dizbad) adlı kəndlər vardır.
485 Damğan – İranın şimalında, Simnandan şimal-şərqdə yerləşən şəhər.
486 Musa peyğəmbər.
487 Cərməğan – Əbivərd yaxınlığında.
488 Cürcan (Gürgan) – İranda tarixi vilayət. Xəzər dənizinin cənub-şərq sahillərini əhatə edir.
489 Vəramin – Tehran yaxınlığındadır.
490 Tarom – Cənubi Azərbaycanda, Zəncanla Rəşt arasında bölgə.

- Şahrux elə bir padşahdır ki, arzusuna və kamına çatacaqdır. O, Sahibqiranın varisidir. Əgər Sultaniyyə qalasından və Qəzvindən əlini çəksən, biz də o həzrətdən xahiş edərik ki, Azərbaycan və İraqi-Ərəb məmləkətini Rum və Şam sərhədinə qədər sənə versin və Herat tərəfə qayıtsın.

Lakin o, bundan sonra da qətiyyən tənəzzül etmədi, elçini həbs etdirdi və artıq-əskik sözlər söylədi.

Nəzm

"Dedi ki, mən bu mülkü mübaliğəsiz surətdə,
Tutmuşam dəbilqəni yaran qılıncım ilə.
Sən də məndən onu ancaq qılıncla ala bilərsən,
Əgər asanlıqla tuta bilsən, təəccüblənərəm.
Nə tifil uşağam ki, bir kəsin təhdidindən qorxum,
Bu təhdidə görə ayağımı bu işdən geri çəkim.
Nə də bixəbər divanə deyiləm ki,
Filosofun sözündən qorxub-çəkinim.
Nə də ağciyər deyiləm ki, savaşdan qorxum,
Savaşda ayağımın daşa dəyəcəyindən ehtiyat edim.
Özüm padşah olduğum halda niyə kimsənin arxasınca gedim?!
Mən aslanam, kimsənin arxasınca sülənən köpək deyiləm.
Əgər bu həvəs üstündə başımı kəssələr belə,
Nəfəsim var ikən bu sözləri deməkdən vaz keçmərəm".

Azərbaycan, Arran[491] və Bağdad diyarının bölgələrindən çoxlu qoşun və saysız əsgər topladı və sabiq zamanlarda, keçmiş qərinələrdə hər nə toplamışdısa, onlara payladı. O, ənənəvi olmayan bir üsula əl atıb Təbriz vilayətindən piyada qoşun təşkil etdi və xəstəliyinin şiddəti üzündən kəcavədə oturub o tərəfə doğru yola çıxdı. Orduya baxış keçirdi. Günəşin zərrələri kimi çoxlu və ağacların yarpaqları kimi sonsuz idilər. Hamısı ürəklərində qorxuya və cəsarətsizliyə yer olmayan növrəstə cavanlar idilər.

Nəzm

"Bu, elə bir qoşun idi ki, başdan-ayağa zirehə qərq olmuşdu,
Dəmir dənizi kimi dalğalanmaqda idi.
Qazan kimi hərb atəşindən qaynamaqda,
Kin küləyindən dərya kimi gurlamaqda.
Türk dilbərlərinin gözü kimi qan tökməkdə,
Mərdlərin qanının qəsdi ilə kin qılıncını itiləməkdə".

Türkmanlar qarşıdurma və vuruşma iddiasında idilər və özlərinin Şahrux padşaha qarşı döyüşə biləcəklərini düşünürdülər. [Qara Yusif] soyuğun hücumuna, oğullarının və əmirlərinin təfriqəçiliyinə, özünün xəstəliyə tutulmasına baxmayaraq, döyüş meydanına tələsdi. Ucanın iki fərsəxliyinə çatdıqda əcəl qasidi (ölüm mələyi) özünü yetirdi və o, şahlıq taxtından tabut taxtasına minib, axirət mənzillərinin ilki olan qəbir yurduna daxil oldu[492].

Nəzm

"Hökumət büsatını qurmuşdu,
Lakin həyat ona heç möhlət vermədi.
Heç kəs belə qəribə şahmat oyunu görməyib,
Bir tərəfdən şah görünür, digər tərəfdən mat".

Ordugahın ərazisi şahın mat olması ilə dağılan şahmat (şətrənc) büsatı kimi bir-birinə dəydi. Xeyli sayda yoxsul piyada vardı ki, fil görkəmli atlara mindilər və yetərincə padşahzadələr də vardı ki, dövlət atından piyada olub rəzalət torpağına üz qoydular. Alçaqların və əclafların qovğası ilə cəbbəxana və xəzinə külək kimi sovruldu. Nəfis cavahirat avaraların və lotu-potunun əlinə düşdü. Cah-calal sahiblərinin çadırlarına

---

[491] Arran – burada Azərbaycanın Kür və Araz çayları arasındakı əraziləri nəzərdə tutulur.

[492] Həsənkeyf hakiminin Misir sultanına yazdığı məktuba əsaslanan Ə.Nəvai *(Şərhlər, s.237)* Qara Yusifin zəhərləndirilərək öldüyünü və bu işin hiyləgər və fırıldaqçı bir adam olan Əmir Şahməlikin casusları tərəfindən törədildiyini güman edir.

və alaçıqlarına zaval və pərişanlıq tozu qondu. Bu üzdən türkman ordusu xəzinəni və cəbbəxananı qarət etdi. Onu kəfənləyib dəfn etmək işini də icra etmədilər. Onu çadırına atıb, hətta qızıl sırğa üçün qulağını kəsdilər.

Əmirülümərа olan Əmir Qaraman [Qara Yusifin] ən sevimli xatunu olan Qədəm Paşa ilə birlikdə istədilər ki, onun oğullarından birini səltənətə oturtsunlar. Lakin onlardan heç biri orada deyildi: Əmir Şah Məhəmməd Bağdadda idi; Mirzə İsgəndər Kərkükdə[493] idi; İsfahan mirzə Adilcevazda idi; Mirzə Cahanşah Sultaniyyədə idi; Əmir Əbu-Səid isə Ərzincanda idi. [Bu səbəbdən] o fikir həyata keçmədi. Əmir Misirin oğlu və Əmir Qara Yusifin qardaşı oğlu Qazan xəzinələrdəki nəfis əşyaları ələ keçirib Avnik qalasına yönəldi. Əmir Qaraman və Qədəm Paşa Əlincəq qalası tərəfə getdilər. Digər qardaşı oğlu Zeynal bəy Yarəli oğlu Ərbil tərəfə getdi. Əmir Bayəzid Ayinlü Kürdüstan tərəfə hərəkət etdi. Məhəmməd Cəngi və Əmir İlyas Diyarbəkrə yollandılar. Səədlü camaatı İsfahan mirzəni səltənətə yüksəldib Bayəzid qalasını[494] və oradakı xəzinəni ələ keçirdilər və Çuxursəəddə[495] qışlaq etdilər.

Qara Yusifin Sultaniyyə hakimi olan oğlu Mirzə Cahanşah, Şahruxun gəlişi xəbərini eşidincə qalanı möhkəmlətməyə və azuqə toplamağa başladı. Türkmanlar Sultaniyyəni qarət edib dükanların qapılarını və taxtalarını qalaya gətirdilər. Rəiyyətdən hansı birinin ki gücü-qüvvəti vardı, onlar qalaya daxil oldular. Qalanları isə Gilan tərəfə dağılışdılar. Birdən Təbriz tərəfdən bir qasid qan axıdan və yaş tökən gözlərlə gəlib çatdı və xəbər verdi ki, “Qara Yusif Səidabadda[496] dünyadan köçdü”. Türkmanlar və Cahanşah bu hadisədən heyran, sərgərdan və pərişan oldular. Mirzə Cahanşah qardaşı Əmir Şah Məhəmmədin hüzuruna getmək əzmi ilə Bağdad tərəfə yola düşdü.

Qara Yusifin vəfatının xəbəri Ərzincana çatdıqda, o diyarın əhalisi Təhərtənin nəvəsi Yarəlini özlərinə əmir edib, Qara Yusifin [oğlu] Əmir Əbu-Səidi qarət edərək şəhərdən çıxardılar.

Mirzə İsgəndər atasının vəfatından sonra səltənət taxtına əyləşdi. Atasının xəzinəsini qarət edərək Bağdada getmiş el və ulus Şah Məhəmməddən iltifat görməyib, Mirzə İsgəndərə qoşuldu. O, Mardin tərəfə hərəkət etdi.

Qara Yusif dünyadan köçdükdən sonra ertəsi gün Seydi Məhəmməd Kəccani və digər böyüklər və əhali Əmir Şahməlikin mülazimi Payəndəni həbsdən çıxardılar və ondan üzr istədilər.

Qara Yusif vəfat edən zaman Şahrux padşah Reydə ibadətlə məşğul idi. Qəflətən fəryad etdi ki, “Qara Yusif Türkman öldü”. Onun tarixini qeyd etdilər[497].

Şahrux padşah, Mirzə Baysunquru Təbriz tərəfə göndərdi və özü də nəfis vücudu ilə üfüqdən doğub yüksəklik dərəcələrini qət edə-edə ekvatora üz tutan günəş kimi köçə-köçə Sultaniyyəyə yönəldi. Adlı-sanlı şahzadə Cuki mirzə, əmirlər, dövlət ərkanı və məmləkət hakimləri onun qələbə ayətli bayraqlarının kölgəsində ulduzlar kimi bu tərəfə sarı üz tutdular. Zilqədə [ayının] 14-də (02.12.1419) Sayınqalaya[498] çatdı və ayın 15-də məiyyət və ordu ilə cah-calallı surətdə Sultaniyyəyə daxil oldu. Rəiyyət Cahanşahın gedişindən sonra can qorxusundan qalaya pənah aparmışdı. O həzrət mükəmməl mərhəməti üzündən rəiyyətə buyurdu ki, “ordumuzun hamısı keçib getməyincə qaladan çıxmayın” və Əmir Musanı o şəhəri mühafizə etmək üçün qoydu.

Mirzə İbrahim sultan Fars və Kirman ordusu ilə Sücas yolundan Marağaya getdi. Mirzə Baysunqur döyüşsüz, davasız, fitnə-fəsadsız və qansız şəkildə Təbriz şəhərinə daxil oldu və İbrahim Cakunu İsfahan bəyin ardınca sürətli yürüş etməyə göndərdi. Onlar Muşun Avə [adlı yerində] İsfahan bəyə çatdılar. O, can qorxusundan mallarını və əşyalarını atıb Hamid ətrafında qardaşı Mirzə İsgəndərə qoşuldu. Şahrux padşah Sul-

---

[493] Kərkük – indiki İraq Respublikasının şimal-şərqində, Dəclə çayına tökülən Kiçik Zab və Tauq çayları arasındakı ərazidə yerləşən və orta əsrlərdən etibarən İraqın türk əhalisinin vətəni olan bir şəhərdir.

[494] Bayəzid qalası - Türkiyənin şərqində, müasir Türkiyə – İran sərhədi yaxınlığında, Maku şəhərindən şimal-qərbdə yerləşən Doğubeyazıt nəzərdə tutulur.

[495] Çuxursəəd – orta əsrlərdə Azərbaycanın tarixi ərazilərinin şimal-qərb hissəsini təşkil edən vilayət. Səfəvilər dövründə mərkəzi İrəvan şəhəri olan Çuxursəəd bəylərbəyiliyi mövcud idi.

[496] Səidabad – Təbrizin üç mənzil cənub-şərqində, Ucanın isə iki fərsəx şimal-qərbində yerləşən kənd *(F.Sümer. Kara Koyunlular, s.110).*

[497] Dövlətşah Səmərqəndinin öz təzkirəsində yazdığına görə, “bundan on gün sonra Qara Yusifin ölüm xəbəri gəldi” *(Nəvai, şərhlər, s.239).*

[498] Sayınqala – İranın Qərbi Azərbaycan vilayətinin cənub-şərqində yerləşən və bu gün rəsmi sənədlərdə Şahindej adlanan yaşayış məntəqəsi.

taniyyədən keçib Ərdəbildə Şeyx Xoca Əli Səfəvi ilə söhbət etdi və zihiccə ayının 9-da (28.12.1419) Qarabağda qışlaq yurduna gəldi.

Qara Osman Bayandurun oğlu Əmir Əli bəy[499] Təbrizdə dustaq idi. Qara Yusif, Şahrux padşahın xəbərini eşitdiyi zaman istədi ki, onu qətlə yetirsin. Əmir Qaraman ərz etdi:

- İndi Şahrux padşah böyük bir ordu ilə gəlməkdədir. Əgər Qara Osman öz oğlunun qətli xəbərini eşidərsə, o da qantökən ordusu ilə Təbrizə hərəkət edəcəkdir.

Qara Yusif bu sözü qəbul edib onu həbsdə saxladı. Qara Yusifin ölümündən sonra Əmir Qaraman onu həbsdən çıxarıb Mirzə Baysunqurun qabağına gəldi və hörmətlə qarşılandı. O, bir neçə gündən sonra mirzənin izni ilə atasının yanına getdi. Mirzə Baysunqur, Baba Hacı bəy Gavərudini tabe etdikdən sonra Qarabağa yollandı.

**Müxtəlif əhvalatlar**

Bu il Şir Məhəmməd-oğlan, Sarıq-oğlan[500] və Sədri-İslam Səmərqəndə gəldilər. Mirzə Uluğ bəy onlara tam hörmət göstərib yenidən Moğolustan diyarına göndərdi.

Həmçinin bu il Şirazda olan Xətay elçiləri izin alıb öz diyarlarına yollandılar.

Bu il Mirzə Uluğ bəy rəsəddən nəticə çıxarmağa və zic[501] hazırlamağa meyil göstərdi. Səmərqəndin şimalında məşriqə meyilli şəkildə qabil və layiq bir yer təyin etdi. Adlı-sanlı alimlərin məlumatı əsasında bir rəsədxana qurdu ki, o işi həyata keçirsin və onun binasını və özülünü öz dövlətinin təməli kimi davamlı və öz səltənəti kimi möhkəm etdi. Binasının möhkəmləndirilməsi və sütunlarının ucaldılması elə həyata keçirildi ki, "Dağların yerindən qopub oynayacağı gün"ə[502] (qiyamət gününə) qədər dağlar kimi zavala uğramaqdan və uçulub dağılmaqdan qorunmuş olsun. Doqquz göyün astronomiyasını, yeddi planetin şəkillərini, fələklərin onluq dərəcələrinə qədər dərəcələri, dəqiqələri və saniyələri, yeddi səyyarə ulduzlarının dövrlərini, sabit ulduzların surətlərini, yer kürəsinin astronomiyasını, iqlimlərin növlərini dağlarla, dənizlərlə, çöllərlə və ona aid olan digər nəsnələrlə birlikdə ürək oxşayan naxışlarla və bənzərsiz xətlə Şəddadın[503] naxışlı qəsrinə oxşayan o yüksək bünövrəli və uca görkəmli imarətdəki otaqların içinə (divarlarına) qeyd edib yazdırdı. Günəşin və s. ulduzların təqvimini rəsədlə müşahidə edərək, hikmətli cənab Xoca Nəsirəddin Tusinin hazırladığı yeni Elxani zicinə ("Zici-cədidi-İlxani") incilər və incəliklər əlavə etdi. Günəşin və digər ulduzların təqvimi ilə bağlı aşkar fərqlər ortaya çıxardı. Böyük alimlər həmin incə və mühüm işdə onun yardımçısı və köməkçisi idilər[504]. Bu böyük işin sorağı şəhərlərə və ölkələrə yayıldı və məşhur oldu. Şahzadə həmin zici düzəltməyə müvəffəq olub onu tamama yetirdi və [bu zic] "Zici-sultaniyi-Kürəkani" adlandırıldı.

**Ölümlər**

Qara Yusif döyüş meydanında qan içən bir aslan və əyləncə məclisində gövhər saçan bir bulud idi. Ədaləti və insafı ilə tanınmış, alicənab və səxavətli birisi kimi vəsf edilmişdi.

Nəzm

"Ay çöhrəli gözəllərin üzünə bənzəyən ədaləti sayəsində,
Bir yerə cəm olmuşdu su və atəş".

Əxlaqının gözəlliyi baxımından bütün dünya əhlindən üstün idi və cəmi əmrlərində və qadağalarında Ulu Tanrının qorxusunu göz önündə saxlayardı. Ümumi camaatla və bütün insanlarla ədalətlə rəftar edərdi. Zalımları cəzalandırmağa, məzlumları himayə etməyə çalışırdı. Əkinçiliyin artırılmasına, aləm əhlinin ərzaq təminatının səbəbkarı olan kəndlilərə və əkinçilərə qayğı göstərilməsinə səy edib diqqət yetirirdi. Məmləkətlərin qorunması və yolların mühafizəsi üçün ədalətli naiblər və yetərincə qabiliyyətli məmurlar təyin edirdi.

---

499 Əslində Qara Osmanın oğullarından Əli bəy deyil, Yaqub bəy əsir alınmışdı *(Nəvai, şərhlər, s.240).*

500 Paris nüsxəsi: "Sarı-oğlan".

501 Göy cisimlərinin hərəkətini və vəziyyətini göstərən cədvəl.

502 *Qurani-Kərim, "Tur" surəsi, 10-cu ayə.*

503 Şəddad – dini mətnlərdə adı keçən və Ad qövmündən olan qədim Yəmən hökmdarı.

504 Bu işdə Uluğ bəyə dörd nəfər alim kömək etmişdir: Qazızadə Rumi adı ilə tanınan Səlahəddin Musa; atasının peşəsi səbəbi ilə Quşçu adı ilə tanınan Əlaəddin Əli ibn Məhəmməd Səmərqəndi; Qiyasəddin Cəmşid Kaşani; Müinəddin Kaşani *(Nəvai, şərhlər, s.242).*

Əsgərlərin ülufələrinin verilməsi və haqq sahiblərinin yaşayışının təminatı yönündə bir dəqiqə belə səhlənkarlıq etməzdi. Din əmrinə rəvac verilməsində, peyğəmbərlərin ağasının (Məhəmməd peyğəmbərin) şəriətinin hökmlərin yerinə yetirilməsində, xeyriyyə binalarının təmirində, mədaxilin və vəqflərin artımında səylər göstərdi. Üzüyünün möhüründə [ərəbcə] belə nəqş edilmişdi: "Ədalət göstərən məlik (padşah) olar, zülm edən həlak olar".

Səltənətinin müddəti on dörd il, şərəfli ömrünün müddəti isə altmış beş il olmuşdur. Məmləkəti Azərbaycan, İraqi-Ərəb, İraqi-Əcəmdən Qəzvin, Həmədan və Diyarbəkrin bəzi yerləri idi.

Öz səltənəti əyyamında altı döyüş etmişdir: birinci döyüşü – Mirzə Əbu-Bəkrə qarşı Pasində[505]; ikinci döyüşü – Mirzə Miranşah və Mirzə Əbu-Bəkrə qarşı Təbrizin Sərdrudunda; üçüncü döyüşü – Qara Osman Bayandura qarşı Muş səhrasında; dördüncü döyüşü – Sultan Əhməd Cəlairə qarşı Şənbi-Qazanda; beşinci döyüşü – yenidən Qara Osmana qarşı Erqani qalası [yanında]; altıncı döyüşü – Şirvan valisi Sultan İbrahim və Gürcüstan hakimi Küstəndilə qarşı.

Onun əzəmətli və şan-şöhrətli övladları. Altı oğlu vardı: 1. Mirzə Pirbudaq – onun səltənəti zamanında vəfat etmişdi; 2. Əmir Şah Məhəmməd – Bağdad valisi idi; 3. Mirzə İsgəndər; 4. Mirzə Cahanşah; 5. Mirzə Əbu-Səid; 6. Əmir İsfənd.

Onun vəfatının tarixi haqqında demişlər:

"Təbriz şahı Mir Yusifin vəfatı,
Yazıldı "kitabət" tarixi ilə"[506].

Onun vəziri Əmir Cəfər Cucə və Əxi Əmir Şeyx idi.

## 823-CÜ İLİN (17.01.1420 – 05.01.1421) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### Zəmanənin şahı Qara Yusifin oğlu Mirzə İsgəndərin Qara Osman Bayandurla müharibə etməsi

Mirzə İsgəndər atasının səltənət tacını başına qoyandan sonra qoşun tərtib etməklə məşğul oldu və saysız-hesabsız, ucsuz-bucaqsız bir ordu topladı.

Nəzm

"İqtidarı üçün rəvan bir şəkildə topladı,
Saysız-hesabsız qədər çoxlu bir ordu.
Rəşadətli bir qoşun ki, savaş zamanı,
Çıxararlar timsahın ağzından dişini".

O, Kərkükdən və Tovuqdan[507] köç edib Mosula gəldi. Qara Osman Bayandur bir dəstə cəsur süvari ilə onun qarşısına çıxdı. Zəfərə yaxın olan hökmdar (Qara Osman) Mardinə çatdıqda, o diyarın valisi olan Tanrıvermiş (Tenqrivermiş) şəhər darvazasını bağlayıb müxaliflik etməyə başladı. Qara Osman mühasirə etmədən Nüsəybin[508] şəhərinə yola düşüb, oradan keçərək Şeyxkəndində[509] dayandı. O əsnada Bəhram kimi intiqamçı ordunun qaravulları xəbər gətirdilər ki, Mirzə İsgəndər Şəmalıq çayından[510] keçib Cəzirəni[511] arxada qoymuşdur.

Bu xəbər ali [hökmdarın] qulağına çatdıqda, köç edib Mirzə İsgəndərin qarşısında səf bağladı. Hər iki tərəf qılınca və nizəyə əl atıb bir-birinə həmlə etdi. Hər iki tərəfdən bir çoxları həlak torpağına düşdü. O əsnada Zeynal bəy Yarəli oğlu Mosuldan, Qara Yusifin qardaşı oğlu Mirzə Əli Ərbildən, Cənglü Həsən Kərkükdən və Cəzirə hakimi Əmir Şəmsəddin[512] üç min nəfərlə Mirzə İsgəndərə köməyə gəldilər. Yenidən cöv-

---

505 Pasin – Ərzurumun şərqindəki Dəvəboynu dağından Qarsdakı Soğanlı dağlarına və Aladağa qədər uzanan və Araz çayının yuxarı axarları boyunca yerləşən ovalıq və tarixi mahal.

506 Qəribədir ki, Həsən bəy Rumlu, Qara Yusifin ölüm tarixini 822-ci ilə aid etsə də, onun maddeyi-tarix kimi verdiyi "kitabət" kəlməsinin əbcəd hesabı 823-ə bərabərdir. Əslində Qara Yusif pəncşənbə günü, 7 zilqədə 823-cü ildə (13.11.1420) ölmüşdür *(Nəvai, şərhlər, s.237,243).*

507 Tovuq (Tauq, Tavuk) – Kərkükdən cənubda yerləşən kənd.

508 Nüsəybin (Nusaybin) – Türkiyənin Suriya ilə sərhədində, Mardindən cənub-şərqdə yerləşən şəhər.

509 Şeyxkənd – Diyarbəkr yaxınlığındadır.

510 Şəmalıq (Şəmaluq) – Böyük Zab çayının bir qolu *(Öztürk, şərhlər, s.134).*

511 Cəzirə - Türkiyənin Suriya ilə sərhədində, Şırnak vilayətinə bağlı Cizre ilçəsi.

512 "Kitabi-Diyarbəkriyyə"yə görə: Məcdəddin *(Nəvai, şərhlər, s.245).*

şən geymiş igidlər Əxzər dənizi[513] kimi coşub-gurladılar, sərsəri kin küləyi ilə hərb alovunu alışdırdılar və ürək deşən oxun ucu və cahanı yandıran nizənin şöləsi ilə döyüş meydanını qızışdırdılar.

O gün Mirzə İsgəndər erkək aslan (şiri-nər) kimi düşmən səfi üzərinə hücum edib qılınc zərbəsi ilə süvarilərin başlarını zillət torpağı üzərinə saldı.

Nəzm

"Qılıncın nəfəsi başları elə salırdı ki,
Nizədən başqa başını qaldıran kimsə qalmadı.
Bəlarək[514] su sürahisi kimi incəldi,
Mizraq isə külək kimi sovruldu.
Nizə fikir kimi canda yer tutdu,
Ox isə nur kimi gözə sancıldı".

Savaş günləri iyirmi günə çatdı. İyirmi birinci gün hər iki tərəfdən hərb atəşi tünd və kəskin şəkildə yandırıldı və döyüş meydanı qiyamət gününə döndü. Qara Osman tərəfində vuruşan adlı-sanlı cavanlar öldürüldülər. Əmir Osman qızmış bəbir kimi Qaraqoyunlu ordusuna həmlə etdi. O əsnada Mirzə İsgəndər bir dəstə cövşən geymiş bahadırla dayanmışdı.

Nəzm

"Öz səfinin yaxınlığında şahzadə,
Dəmir bir dağ kimi dayanmışdı.
Əlində süsən və gül kimi qılınc və qalxan,
Biləyində sünbül zülf kimi bir kəmənd".

Onlar birdən Qara Osmanın üzərinə at çapdılar. Onu yəhərin üstündən yer üzünə saldılar. Əmrullanın oğlu Bistam, Məhəmməd İnaq Xəliloğlu, Yaxşıbəyoğlu, Xızır bəy, Cərsun Xoca Əli, Həmzə Xəzindar, Həsən Əlaəddinbəyoğlu və Osman bəyin oğlu Bayəzid bəy mərdliklə vuruşdular. Qara Məhəmməd adlı birisi atdan enib Qara Osmanı [ata] mindirmək istədi. Lakin Osman çox yara aldığından və əl-ayağında təpər qalmadığından ata minə bilmədi. Qara Məhəmməd başını onun iki budunun arasına soxub onu qaldırdı və ata mindirdi. Yenidən Mirzə İsgəndər həmlə etdi. Qara Osmanın bir sıra adamlarını əsir edib yenidən Qara Osmanı atdan aşırdı. Daha bir neçə dəfə çoxlu süvari onun başına toplanıb yenidən onu ata mindirdilər. İnaq Xəlilin oğlu Məhəmməd, Yaxşı bəyin oğlu, Xızır bəy, Qara Məhəmməd, Əlaəddin bəyin oğlu Həsən əsir alındılar. Bu əsnada oğlu Əli bəy köməyə gəldi və atasını döyüş meydanından kənarlaşdırdı. Qara Osman yaralarına və sınıqlarına baxmayaraq, oğullarına dedi:

- Fərar etmək xilas yolu deyildir. Yaxşısı budur ki, döyüşə-döyüşə buradan çıxaq.

Ona görə də oğulları və başqa əmirləri qoşuna həmlə etdilər. Məhəmməd Xəzinədar[515], Çənanoğlu Sultan, Ağ Məhmad, Məhəmməd Bukavul, Əli bəy və Qaraman döyüşə-döyüşə Qara Osmanı savaş meydanından çıxardılar.

O əsnada bəzi adamlar fərar etmişdilər və Əli bəy onları oxa tutaraq geri qaytardı. Qara Osman böyük bir kədərlə Həmidə yollandı. O, düşmənin müşahidə olunduğu yerdə yavaş-yavaş, rəqibin görünmədiyi zaman isə sürətlə gedirdi. Qara Osman deyirdi ki, "şir bu cür fərar edir: bir adam göründüyü zaman yavaş-yavaş, heç kim olmadıqda isə sürətlə".

## Şahrux padşahın Qara Yusif Türkmanın övladları ilə müharibə etməsi haqqında söhbət və bəzi zaman hadisələrinin, dövran təbəddülatlarının təsviri

Şahrux padşahın Qarabağda qışlaq etdiyi qış mövsümündə Şirvan valisi Əmir Xəlilulla, qardaşı Mənuçöhr, Şəki hakimi Seydi Əli oğlu Seydi Əhməd, Seyid Əhməd Qaramanlı, Əmir Şeyx Qəbbani, Gürcüstan valisi Əlisgəndərin (Aleksandrın) elçiləri, Moğolustan padşahının elçisi İdkur Yarğuçi, Gilan padşahı Əmir

[513] Bəhri-Əxzər (ərəbcə "yaşıl dəniz" deməkdir) – klassik müsəlman coğrafiyaşünaslarının Atlantik okeanına verdikləri ad (bax: *A.Quliyev. Azərbaycanın görkəmli səyyah və alimi Hacı Zeynalabdin Şirvani. Bakı, 1964, s.62*).
[514] Bəlarək – həddən artıq gövhərlə bəzədilmiş (cövhərdar) qılınc növü *(Nəvai, şərhlər, s.245)*.
[515] Nüsxələrdəki bəzi məlumatlara görə: Məhəmməd Xəzinədarın oğlu Mehman bəy *(Nəvai, şərhlər, s.246)*.

Seyid Rzanın əmisi oğlu Əmir Heydər Kiya və Məlik İzzəddin Şir bir-birinin ardınca çoxlu peşkəşlə kama çatmış padşahın zəfər şüarlı ordusuna gəldilər.

Fərvərdin [ayında][516] aləmi bəzəyən günəş Balıq bürcündən Qoç bürcünə çatdıqda qışın qoşunu yaz ordusunun ön dəstləri qarşısında geri çəkildi, yüngül ayaqlı külək fərraşlığa qədəm qoydu, çevik əlli bulud naqqaşlıq etməyə əl uzatdı, qüdrət əli yer üzünün ağ paltarını yaşıl libasla əvəz etdi və çəmənin yaxşı çöhrəsini bitkilərin yaşıl rəngi ilə bəzədi. Üfüqlər padşahı (Şahrux) rəbiüləvvəl [ayının] 19-da (03.04.1420)[517] qışlaqdan çıxıb Təbrizə yönəldi. Hökmdar tərəfindən fərman verildi ki, Mirzə İbrahim sultan və Əmir Şahməlik iyirmi min süvari ilə Mirzə Əbu-Səidin və Mirzə İsfahanın yurdu olan Naxçıvan və Səlmatu[518] tərəfə hərəkət etsinlər. Əmirlər buyruğa əsasən, o diyara tərəf hərəkət etdilər. O əsnada Mirzə İsfahanın mülazimləri fələk şövkətli orduya gəlib padşaha sədaqət ərz etdilər. O həzrət onlara hörmət göstərib geri göndərdi.

Qaraköpək[519] mənzilində ərz etdilər ki, Yarəhməd Qaramanlı cəhalətinin və nadanlığının çoxluğu üzündən müxaliflik və itaətsizlik göstərməyə başlamış, Gəncədə və Bərdədə olan əmirlərin mülazimlərini qarət etmişdir. Ona görə də (Şahrux) Mirzə Baysunqura onları dəf etmək göstərişi verib o tərəfə göndərdi. Yarəhməd sayı yağış qədər olan ordunun gəlişindən xəbərdar olub Səfərzən qalasına[520] pənah apardı. Mirzə Baysunqur qalanı mühasirə etdi. İki-üç gündən sonra Yarəhməd acizlik və çarəsizlik üzündən inadı tərk edib aşağı endi. Mirzə Baysunqur onu aləmin pənahı olan dərgaha çatdırdı. O həzrət (Şahrux) onu Əmir Çaharşənbəyə tapşırdı.

O əsnada Təhərtənin nəvəsi Əmir Əlinin elçiləri və Gürcüstan hakimi İvaninin mülazimləri cəmadiyüləvvəl [ayının] başlanğıcında (14.05.1420) hökmdarın ordusuna gəldilər və elə həmin zaman Əmir Şahməlikin qasidləri xəbər gətirdilər ki, Qara Osman, Mirzə İsgəndərə məğlub olmuşdur. [Dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin padşahı cəmadiyüləvvəl [ayının] 3-də (16.05.1420) Araz çayını keçib Mastəkul[521] civarında dayandı. Cəmadiyüləvvəl [ayının] 23-də (05.06.1420) Bayəzid qalasının çevrəsi qurunun və dənizin hökmdarının dayanacaq yerinə çevrildi. Ora elə bir qaladır ki, uca bir dağ başında yerləşir və hündürlüyü o dərəcədədir ki, səba küləyi onun ətəyindən belə keçə bilmir. İstehkamı o qədər möhkəmdir ki, mükəmməl biliyə malik uzaqgörən ağıl belə oranı fəth etmək fikrinə qapıla bilməz.

Nəzm

“Aşiqlərin əhdi kimi hasarı möhkəm,
Göyün mətanəti kimi təməli davamlı.
Asimanın yeddi qatı kimi yeddi divarı var,
Bürcləri baş qaldırıb ulduza.
Onun yolundan fikir peyki yorulmuş,
Acizliklə yarı yoldan qayıtmış.
Ora çıxan qıvrım-qıvrım və dar yol,
Dilbərin zülfü və gözü kimi ağlı başdan alar.
Oraya qoymuşlar poladdan bir qapı,
Sərtlikdə xəsisin qəlbi ilə bərabər”.

Xülasə, zəfər şüarlı əsgərlər həmin gün şəhərbəndi alıb istila bayrağını yüksəltdilər və Mirzə Baysunqurun mülazimləri cəsarətlərinin çoxluğundan dağ belindəki qaya üzərində yerləşən bir neçə bürcə doğru hərəkət edib bürcü deşdilər. Dağ başında olan neçə nəfər şövkətli bahadır özlərini qalaya çatdırıb qalanı tutdular və qələbə şüarlı qoşunların əlinə çoxlu qənimət düşdü.

---

516 Fərvərdin – İran günəş təqviminin ilk ayı (21 mart – 20 aprel).

517 Əslində bu hadisələr h. 824 / m. 1421-ci ilə aid olmalıdır *(İ.Aka. Şahruh Mirza, s.120-125).*

518 “Mətləüs-səadeyn”də bu yerin adı belə yazılmışdır: “Türkman əsilli Səəd oğlunun qədim yurdu olan Sərmatu” *(Nəvai, şərhlər, s.247).* Əslində burada Sürməli bölgəsi (Türkiyənin indiki İğdır vilayəti) nəzərdə tutulmuşdur (bax: *F.Sümer. Kara Koyunlular, s.118*).

519 Qaraköpək – indiki Füzulu rayonunda kənd. Başqa adı Şəkərcik və ya Şəkərli olmuşdur.

520 F.Sümerə görə, bu, “Gürcüstan torpağındakı Esferzen qalasıdır” *(F.Sümer. Kara Koyunlular, s.118).*

521 Bəzi nüsxələrdə Masyəkul yazılıb *(Nəvai, şərhlər, s.248).*

Ondan sonra ləyaqətli hökmdar Aladağa yollanıb, İrənci dağının ətəyindən adlayaraq, Abaqa sarayından (Sərayi-Abaqa) keçməklə Əxlata[522] yönəldi. Yol əsnasında Əmir Qanaşirini Adilcevaz qalasını fəth etməyə göndərdi. Adı çəkilən əmir o qalanı tutub əzəmətli orduya yollandı.

Mirzə İsfahan Muş səhrasında dəniz kimi coşan və ildırım kimi gurlayan ordunun gəlişi üzündən o vilayəti tərk edib Diyarbəkrdə Mirzə İsgəndərə qoşuldu. Onu təqib edən Əmir İbrahim Caku onun mallarını ələ keçirib fələk şövkətli orduya döndü. Muş qalasının kutvalı Əmir Əbdürrəhman da qalanı təslim etdi. Bitlis valisi Əmir Şəmsəddin və Qara Osman özünün Əli bəy və Bayəzid bəy [adlı] oğulları ilə birlikdə bir-birin ardınca hökmdar ordusuna qoşuldular. O həzrət dərgahına gəlmiş Diyarbəkr hakimlərinə hörmət göstərib xələt verdi və onlara [getmək] icazəsi verərək, öz nəfis vücudu ilə Təbrizə yönəldi.

O əsnada xəbər çatdı ki, Qara Yusif Türkmanın oğulları bir dəstə bahadırla Əxlat ətrafına gəlmişlər. Əmir Xəlilulla Şirvan tərəfə, Əmir İsfəndiyar Dərbənd tərəfə, Qustay Arrana, Məliki-Əzəmin (Məlik İzzəddin Şirin) oğlu Məlik Məhəmməd Kürdüstana, Əmir Şəmsəddin Bitlisə və Əmir Məhəmməd Kürd Əxlata yola düşdü. Onların hamısı şərəf və izzətlə qiymətli xələtlərə, şahanə gövhərlərə, yorğa atlara, rəngbərəng papağa, daş-qaşlı kəmərə, cürbəcür ikramlara və növbənöv ənamlara layiq görülməklə ucaldılıb yola salındılar.

O zaman Əmir Şeyx Qəbbani son dərəcə iş bilən adam olduğu üçün dərgaha gəldi, münasib peşkəşlər təqdim etdi və keçmiş ixlasının gözəlliyini layiqli xidmətlərlə birləşdirdi. O həzrət (Şahrux) Mirzə İbrahim sultanı və Əmir Şahməliki Əleykə Calıqla Seyid Əhməd Dizəki dəf etməyə göndərdi. Onlar [bu şəxslərin] elini və ulusunu tutub, hökmdar ordusuna qoşuldular.

Yüksək şanlı əmirlər Qara Osmanla birlikdə məruzə edib dedilər:

- Məmləkətin xaraba qalmağının səbəbkarı Qara Yusifin oğullarıdır. Nə qədər ki onlar yox edilməyiblər, məmləkətdə rahatlıq olmayacaqdır.

Nəzm

“Bu məmləkətin xarabalığı onlardan olmuşdur,
Onlardan cahan pərişan olmuşdur.
Rəiyyət onların zülmündən gileylənir,
Qurdu sürüyə gözətçi etmə sən!”

Ona görə də cahan hökmdarı hərb yarağını, nağaranı və s. hazırlamağı əmr edib Ərciş[523] tərəfə döndü. İlyas Xocanı və Qara Osmanı bir dəstə bahadırla mənqəlay etdi. Ayın 14-də (25.07.1420) Herat tərəfdən xatunlar gəlib hərəmdə yerləşdilər. Mənqəlay əmirlərinin yanında olan Əmir Məhəmməd Xoca Çöhrə[524], Mirzə İsgəndərin qaravulları ilə döyüşüb, iki nəfəri dustaq edərək o həzrətin hüzuruna gətirdi. Qara Yusifin oğulları neçə dəfə elçilər göndərib sülhdən söz salsalar da, bir faydası olmadı.

O həzrət tədricən onların üzərinə köç etdi. Nəhayət, seşənbə günü, rəcəb [ayının] 27-də (07.08.1420) fələk şövkətli ordu Ağadəvə[525] mövqeyində dayandı. Türkman qoşunu Ələşkərd[526] hüdudundakı Yəqşi (Yakşı, Yaxşı) mövqeyində yerləşib xəndək qazımışdı. [Şahruxun qoşunları] birdən ata minib, öz yüklərini (“ağruq”) qoyaraq iki fərsəx irəli gəldilər və ordunun səfini qurdular. Türkman ordusu Xorasan ordusunun fillərindən qorxub çəkinirdi. Çünki onların atları heç vaxt fil görməmişdi. Böyük öküzləri saman çuvalları ilə [yükləyib] filə bənzətdilər, bəziləri gildən fil heykəli düzəltdilər və atları onların üzərinə çapdılar ki, fildən qorxmasınlar. Mirzə İsgəndər bir dəstə igidlə mərkəzdə qərar tutdu. Sağ cinahda Pir Hüseyn bəy Səədlü, Korkan Alpavut, Sərkan Alpavut və Pir Məhmat Səədlü öz tabeçiləri ilə yerləşdilər. Sol cinahda İsfahan mirzə, Bayram bəy və oğlu Şahsüvar bəy dayandılar. O tərəfdən isə Şahrux padşahın [ordusunun] ön dəstəsində (mənqəlay) Baysunqur mirzə, Əmir Şahməlik, Şeyx Loğman Məlik və Şeyx Loğman Barlas, sağ cinahında Şiraz valisi olan oğlu İbrahim sultan, İsfahan valisi Rüstəm mirzə, Şibirğan tiyuldarı Əmir İbrahim Caku və

[522] Əxlat və Adilcevaz – Şərqi Anadoluda, Van gölünün şimal-qərb sahilində şəhərlər.
[523] Ərciş – Türkiyənin şərqində, Van gölünün şimalında yerləşən şəhər.
[524] Qaynağın mətnində yanlışlıqla Çurə (və ya Çevrə) yazılmışdır. Əslində Çöhrə olmalıdır (bax: *İ.Aka. Şahruh Mirza, s.123*).
[525] Tehran nəşrində yanlışlıqla “Ağmadu” kimi yazılmışdır. Ağadəvə – Aladağın ətəyində bir yer adıdır *(M.Öztürk, şərhlər, s.139).*
[526] Ələşkərd – Şərqi Anadoluda, Kağızmandan cənubda yerləşən ovalıq.

Yəzd hakimi Əmir Çakmak Şami, sol cinahında Əmir Firuzşah Tərxan, Qara Osman Bayandur və oğlu Əli bəy mövqe tutdular. [Şahrux] özü isə nəfis vücudu ilə mərkəzdə qərar tutdu.

Nəzm

“Buyurdu ki, ordunun mərkəzinin önündə,
Döyüş filləri ilə bağladılar yolu”.

Döyüş fillərini əsləhə və zirehlə (kəcim) bəzədilər, onların bellərində taxtlar qurdular və oxları qəza-qədər oxu kimi heç vaxt xəta etməyən bir dəstə mahir oxçu onların üzərində oturdular.

Nəzm

“Sandıq qoydular filin belinə,
Yer oldu başdan-başa Nil dəryası kimi.
Döyüş gününün süvarilərindən min nəfər,
Sandıq üzərində ox atan adamlar,
Amansız igidlərdən ibarət bir qoşun seçib,
Buyurdu ki, çərxi-fələk kimi kamanları işlətsinlər.
Piyadalar dayandılar fillərin önündə,
Əgər dağ irəli gəlsəydi, ikiyə bölünərdi.
Daş ürəyi oxla əridirdilər,
Tapmırdı heç kəs o yaraya əlac.
Sonra onların arxasında döyüş süvariləri,
Pərakəndə etdilər tirkeşi xədəngin qorxusundan”.

O dağ görkəmli [fillərin] görünüşündən döyüş meydanının havası mavi rəngə boyandı.

Beyt

“O [fil] yerdə İsgəndər səddi kimi dayanmışdı,
Göyə ucalan qaməti çinar kimi.
Dağ kimi bədənləri dağlar silsiləsini xatırladırdı,
Sürətdə fırtınanın qaldırdığı toz kimi idilər”.

Şahrux padşahın piyada və süvarilərdən ibarət saysız-hesabsız ordusu coşğun dəniz kimi idi. Elə ki hər iki tərəfin qoşunları və səfləri düzləndi, ilk öncə Pir Hüseyn bəy Səədlü bir dəstə bahadırla Şahrux padşahın sol cinahına hücum etdi. Əmir Firuzşah Tərxanla Qara Osman da irəli gedib onlara həmlə etdilər. Bahadırlar ürək deşən oxun və şölə saçan nizənin zərbəsi ilə bir-birini yaralayır və öldürürdülər.

Şeir

“İgidlərə tənə vurmaq üçün o hücum vaxtı,
Ov oxu ağzını açmışdı.
O yığıncaqdakı sənubər qamətlilərin bədəni,
Oxdan gül qönçəsi ilə dolu oldu”.

Səhranın səthi öldürülənlərin əzalarının parçalarından görünməz oldu.

Beyt

“Yerə o qədər baş, əl və ayaq düşdü ki,
Heç bir yer bunlardan boş qalmadı”.

Şahrux padşahın ordusuna məğlubiyyət üz verdi. Əmir Firuzşah Tərxan və Qara Osman Bayandur qaçış yolunu tutdular. Bu məğlubiyyətə görə Şahrux padşah əsla qəlbində kədərə yol verməyib dua əlini göyə açdı, itaət üzünü yerə tutdu və [Allaha] çoxlu yalvar-yaxar etdi. Səyyarələr xosrovu (günəş) bu mavi qübbənin (asimanın) orta həddinə çatdığı vaxtdan onun öz başını qərb üfüqünə çəkdiyi saata qədər qırğın atəşi son dərəcə alovlanmaqda və şölələnməkdə idi.

Şeir

“Elə ki günəş öz ayağını yerin ətəyinə apardı,
Ayın əli tutdu asimanın ətəyindən.
Göyün məkanında zənci şahı (qaranlıq) pusqu qurdu,
Qara torpağın içində Rum məliki (aydınlıq) qərar tutdu”.

O iki kinli ordu müharibə büsatı sərərək bir-birinin qarşısında qərar tutdular. Hər iki tərəf gözətçilər təyin etdi və səhər açılana qədər gözətçilik etdilər. Nəhayət, Şərq sultanı (günəş) özünün nurani bayrağını qaldırdı, yer üzünü zülmətin çör-çöpündən təmizlədi və nurların qılınc çalması ilə gecənin izdihamlı ordusu yox olub getdi.

Şeir

"Səmanın bu ocaq yandıran qatili günəş,
Çıxınca əlində qan tökən qılınc tutmuş halda.
Şərq sultanı (Şahrux) qəzəb üzündən qoydu,
Qızıl saçan günəşini (tacını) öz başına.
Yenidən hərəkətə gəldi hər iki ordu,
Hay-huy səsləri qalxdı döyüş meydanından".

Cağatay qoşunları ordu səfini tərtib edib təqribən yarım fərsəx irəli gəldilər. O tərəfdən Mirzə İsgəndər Türkman ordusunun iki cinahını və mərkəzini həmin qaydada düzdükdən sonra qarşıya gəlib qərar tutdu. Bahadırların həmlə fırtınası və aslan igidlərin hay-huyu yer kürəsini yerindən oynatdı. Hərb dalğalarının təlatümündən qiyamət gününün surəti və məhşər çölünün əlamətləri göründü. Qanın nəmi və buxarı balığın (Səmək) [527] belinə və Balıqlar bürcünün (Simak) qarnına çatdı.

Nəzm

"Döyüş günündə balığa qanın nəmi gedib çatdı,
Ayın üzərinə isə döyüşün tozu qondu.
Qan selinin çoxluğu yeri taqətdən saldı,
Bu sel yeri-göyü bürüdü.
Həriflər fəna camından qan içdilər,
Aşiq kimi bu badədən məst oldular".

O gün Öməşeyxin oğlu Mirzə Rüstəm sağ cinahda elə döyüşdü ki, dastan qəhrəmanı olan Rüstəmin ruhu ona afərin dedi. Əmir İbrahim Cahanşah sol cinahda mərdlik göstərdi və Mirzə İsgəndərin böyük əmirlərindən olan Pir Hüseyn bəy Səədlünü əsir tutdu.

Gündüzün nur bəxş edən çöhrəsi gecənin ənbər qoxulu zülfünün qaranlıqlarında gizləndikdə Şahrux padşah buyurdu ki, zəfər şüarlı qoşunlar döyüş meydanında enib gözətçilik etsinlər.

Beyt

"Açdılar dəmir donlu igidlər,
Gözətçilik etmək üçün zireh kimi iki yüz göz".

[Qaraqoyunlu ordusundan] fərar etmiş bir sıra adamlar ərz etdilər ki, Qara Yusifin oğulları ölümə könül vermişlər (ölümü gözə almışlar). Şərqin sultanı (günəş) qara çadırı yer sakinlərinin üzərindən çəkdikdə və yer üzünü qaranlığın çör-çöpündən təmizlədikdə Şahrux padşah əzəmət və cah-calal bayrağını yüksəltdi. O tərəfdən isə türkman qoşunu günəş zərrələri kimi saysız və yağış damcıları kimi çox idi.

Şeir

"Hamısı kaman çəkən, döyüşkən və ox atan,
Hamısı mübariz, dəmiri əridən və cövşən geyən.
Hamısı bədənini həlak çuxurlarına atmış,
Hamısı xətər nişanələrinə könül vermiş"

İzdihamlı və adlı-sanlı ordunun önündə dağ şəkilli, dərya misallı fillər səf bağladılar. [Qoşunlar] birbirinə qarşı oxla, nizə ilə, xəncərlə hücuma keçdilər. Sağ cinahdan Mirzə Sultan İbrahim, Rüstəm mirzə və İbrahim Caku, Mirzə İsgəndərin [ordusunun] İsfahan mirzə, Bayram bəy, Şahsüvar bəy və Korkan bəy Alpavut tərəfindən qorunan sol cinahına həmlə etdilər və çoxlu döyüşdən sonra onları məğlub etdilər. Öz sol cinahını pərişan halda görən Mirzə İsgəndərin qəzəb atəşi alovlandı və o, Şahrux padşahın ön dəstəsinə (mənqəlay) həmlə etdi. Mirzə Baysunqur, Əmir Şahməlik və Şeyx Loğman Barlas fərar etdilər. Türkmanlar Şahrux padşahın [ordusunun] mərkəzinə üz tutdular. Mərkəzin önündə qızğın fillər və kamandar piyadalar səf bağla-

[527] Səmək – Şərq əsatirlərinə görə, yeri öz üzərində saxlayan balıq *(M.Müin. Fərhəngi-farsi, II c., s.1921).*

mışdılar. [Türkmanlar] bir sıra piyadaları və süvariləri həlak torpağı üzərinə salıb, fillərə çoxlu yaralar vurdular. Onlar hətta öz döyüş atlarını qadınların dayandıqları yerə qədər çapdılar və neçə qatar dəvəni qabaqlarına salıb apardılar. Şahrux padşah bu halı müşahidə etdikdə filləri irəli qovub, bir dəstəni də mərkəzdən onlara qarşı vuruşmağa göndərdi. Fillər dünyanı dolaşan küləklər kimi irəli atıldılar və qraniti deşən dişləri ilə bahadırların bədənlərini dəlmə-deşik etdilər.

Nəzm

"O meydanda qorxusuz-hürküsüz fillər,
Dişlə vurub böldülər adamı iki yerə.
Fillərin iş görən xortumu,
İki yüz məhşər şeypurunu xatırladırdı
Dayanmadı heç kim fil səflərinin önündə,
Bağlamadı bir kəs Nil dəryasının qabağını"[528].

Əmir İbrahim Cahanşah və Mirzə Rüstəm də səy göstərdilər və aslan kimi vuruşdular. Sol cinahda (cəvanğar) Əmir Əlaədin Əleykə Kükəltaş, Əmir Firuzşah Tərxan və Əmir Fərmanşeyx öz yerlərini qorudular. Mirzə İsgəndərin sağ cinahı onlara hücum etdi. Onlar Əmir Butanı və Xoca Məhəmməd Müşərrəf Simnanini hərbçilikdən yaxşı başı çıxmayan bir dəstə ilə birlikdə qətlə yetirdilər. Türkman qoşunlarının qiyaməti xatırladan ardıcıl həmlələri nəticəsində az qaldı ki, qalibiyyətli ordu öz qaydasına və adətinə zidd olaraq qaçış yolunu tutsun.

O əsnada Şahrux padşah buyurdu ki, meydanın ortasına çadır qursunlar və o həzrət ildırım rəftarlı atından enib, günorta namazını qılaraq yenidən ata mindi və mərkəzdə qərar tutdu. O əsnada Əmir Şahməlik buyurdu ki, sevinc nağarası vursunlar və söz yaydı ki, Mirzə İsfahanı tutmuşlar. Türkmanlar bu yalan xəbəri eşitdikdə məəttəl və pərişan oldular. Mirzə Baysunqur düşmənin zəifliyindən agah olduqda böyük bir ordu ilə rəqibin üzərinə getdi. Şahrux padşah beş min süvarini onlara köməyə göndərdi. Özü isə bütün qoşunla birdən həmlə etdi. Gərgin bir döyüş baş verdi. Mirzə İsgəndər çoxlu səy göstərdi ki, öz ordusunun nizam-intizamını qorusun, amma buna nail olmadı. Zərurət ucbatından o, fərar vadisinə üz qoydu. Şahruxun ordusu onları təqib edib bir çoxlarını iti qılınc zərbəsi ilə həlak torpağı üzərinə sərdi[529].

Beyt

"Qılınc zərbəsi ilə onları ikiyə bölürdü,
Bununla da onların sayını artırırdı.
Gah onları zərbə ilə parçalayırdı,
Gah onları yerlə yeksan edirdi".

Osman bəy, Məhmat[530] Səədlünü əsir tutdu. Onun oğlu Əli bəy isə Məhmat bəy Səədlünün oğlu Pirqeybi tutdu. Onları Şahrux padşahın nəzərləri qarşısına gətirdilər. O həzrət Ulu Tanrıya şükürlər edib İraq, Fars, Xorasan, Kirman, Xuzistan, Ümman sahilləri, Məvəraünnəhr, Kaşğar, Toxarıstan, Qəzneyn və Kabil vilayətlərinə, Sind[531] və Hind diyarlarına fəthnamələr göndərdi.

Ertəsi gün köç etdi. Yol əsnasında dünyanın fatehi olan şahın nəzəri türkman əsirlərinə düşdü. O, hamısına yaxşı davranıb, Xoy yolundan Təbrizə gələrək o diyarın idarəçiliyini Qara Osmanın oğlu Əli bəyə tapşırdı. Ramazan [ayının] (09.09-08.10.1420) əvvəllərində müvəffəqiyyət və səadətin müşayiəti ilə Sultaniyyədə cah-calalla dayandı. Zaman şairlərindən biri bu hadisə haqqında demişdir:

Nəzm

"İsgəndər bizim qoşunumuzu vurdu və qaçdı,
Bizim şahımız məmləkəti tutdu və aradan çıxdı".

Zəfərə yoldaş olan hökmdar Qəzvinə çatdıqda, Mirzə İbrahim və Mirzə Rüstəm icazə alıb öz ölkələrinə yola düşdülər. Şəvval [ayının] 19-da (27.10.1420) [Şahrux] səadət və uğurla Herat şəhərinə daxil oldu.

---

[528] Burada döyüş fillərinin həmləsi, Nil çayının daşdığı vaxt yaranan qarşısıalınmaz sellə müqayisə edilmişdir.
[529] Şahrux bu qələbəni h. 824-cü ilin şaban / m. 1421-ci ilin avqust ayının başlanğıcında əldə etmişdir *(Nəvai, şərhlər, s.255).*
[530] Məhmat – Məhəmməd adının türkləşmiş formasıdır *(Nəvai, şərhlər, s.255).*
[531] Sind – Pakistanda tarixi vilayət.

**Şahrux sultanın getməsindən sonra Azərbaycanda baş vermiş hadisələr haqqında söhbət**

Elə ki Şahrux padşahın fərmanı ilə Qara Osmanın oğlu Əli bəy Təbrizdə yerləşdi, o əsnada Qara Yusif Türkmanın oğlu İsfahan bəy ucsuz-bucaqsız bir ordu ilə hərəkət bayrağını Təbriz tərəfə qaldırdı. Əli bəy müqavimət göstərməyə taqət gətirməyib Diyarbəkr tərəfə fərar etdi və yolda döyüşə-döyüşə kürdlərin əlindən xilas olub atasına qovuşdu. İsfahan mirzə tam əzəmətlə darüssəltənə[532] Təbrizə daxil oldu və Əlincəq qalasını da mühafizə etdi.

Bu əsnada Mirzə İsgəndər Tovuq və Kərkükdə idi. O, bu xəbəri eşitdikdə Təbriz tərəfə hərəkət etdi. Mirzə İsfahan o yüksək şanlı padşahın gəlməsi üzündən fərar atını altına çəkib Ərzuruma[533] və Avnik qalasına getdi. Onun da fərar etməsindən sonra İsgəndər Sökmənabadda[534] dayandı və həmin məqamda Kürdüstan hakimləri onun dərgahına gəldilər.

O məkandan köç edib Aladağa yönəldi, oradan Mingöl yaylağına[535] getdi və ov təşkil etdi. Bitlis əmirlərini tutub Kürdüstana yönəldi. Bitlis hakimi olan Şəmsəddin bəyi qalanın qapısına göndərdi ki, qalanı təslim etsinlər. Əmir Məhmat qalanı vermədi. Ona görə də Mirzə İsgəndər onun əmirlərindən bəzilərini qətlə yetirib Əxlata yönəldi. Əxlatda da yaxşı cavanlar vardı. Onlar da qalanı bağlayıb müxaliflik etməyə başladılar. Mirzə İsgəndər, Əmir Şəmsəddini qalanın ətəyinə göndərdikdə, Əmir [Şəmsəddin] kəmərini belindən açıb yenidən bağladı. Onun belə etməkdə məqsədi qalanın qorunmasına işarə etmək idi[536]. [Mirzə İsgəndər] bacarıqlı və çevik cavanları qala ətrafında qoyub Bitlisə yollandı.

**Qara Osman Bayandurun əhvalının cüzi bir qismi və onun Mardin qalasına qoşun çəkməsi haqqında söhbət**

Mirzə İsgəndərlə savaşdan sonra Qara Osman, Şahrux padşahdan izin alıb Diyarbəkrə qayıtmışdı. O ucsuz-bucaqsız bir qoşun toplayıb Mardin qalasını mühasirə etdi. Taxılı [heyvanlarına] yedirib, tarlaları yandırdı. Oradan da qəfil bəla kimi Ərzincan üzərinə getdi. O diyarda da bir sakin qoymadı. O zaman Trabzon[537] sultanı onun ordugahına gəldi. Ərzincanı dövrəyə alıb ərradə[538] və mancanaq tərtib etdilər. O əsnada oğlu Yaqub bəy Kəmaxdan hüzura gəldi və Qarahisar[539] onun soyurğalına[540] əlavə edildi. O qalanı tutmağın çətin olduğunu aydınlaşdırdıqları zaman geri qayıdış təbilini vurdular. [Qara Osman] Həmiddə qışlaq etdi və o şəhərin idarəçiliyini İnaq Həsənə, Bayburdu isə qardaşı oğlu Qutluğ bəyə verdi.

---

532 Darüssəltənə – "sultanlıq məkanı", "səltənət evi", səltənətin mərkəzi, hansısa bir qüdrətli Şərq monarxik dövlətinin paytaxt şəhəri.

533 Ərzurum – Türkiyənin şərqində, Ərzincanla Qars arasında, Qarasu çayı kənarında yerləşən şəhər.

534 İran Azərbaycanında, Xoy şəhərinin şərqində, Türkiyə sərhədinə yaxın bir yerdə olub, Xoya bir-iki mənzil məsafədə idi. Buranın qurucusu Əxlat şahlarından Sökmən əl-Qütbidir və həmin məkan onun adı ilə bağlıdır. Sökmənabada türkcə Sökmən ovası da deyilirdi *(Öztürk, şərhlər, s.146)*.

535 Mingöl yaylağı – Türkiyədə, Araz çayının mənbəyində yerləşən yaylaq *(Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazi. Təkmilətül-əxbar, s.31)*.

536 Bu xəyanətinin müqabilində Mirzə İsgəndər, Əmir Şəmsəddini ölümlə cəzalandırdı *(Nəvai, şərhlər, s.257)*.

537 Trabzon – Türkiyənin Qara dəniz sahillərində şəhər. O zamanlar burada bızanslıların Komnenlər sülaləsinin başçılığı ilə Trabzon Rum dövləti mövcud idi.

538 Ərradə – üzərinə top qoyulmuş araba. Ola bilsin ki, burada üzərinə mancanaq qoymaq üçün istifadə edilən arabalardan bəhs edilir.

539 Qarahisar – bugünkü Girəsun vilayətinin Şəbinkarahisar ilçəsi nəzərdə tutulur.

540 Soyurğal (monqol-tatar dilində "ehsan, bəxşiş, hədiyyə, güzəşt" deməkdir) – monqollar dövründə meydana çıxmış və irsən ötürülən feodal torpaq mülkiyyətidir. Meydana gəldiyi ilk dövrlərdə hərbi əyanlara iri ərazilər şəklində soyurğal verilirdisə, Səfəvilər zamanında aparılan mərkəzləşdirmə siyasəti nəticəsində hərbi əyanlara irsi mülkiyyət olan soyurğal əvəzinə müvəqqəti mülkiyyət olan tiyulların verilməsinə başlandı. Səfəvilərin hakimiyyəti dövründə soyurğalların həcmi xeyli kiçilmişdi. Artıq bütöv vilayətlər deyil, kiçik ərazilər, ayrı-ayrı kəndlər soyurğal kimi verilirdi, həm də soyurğallar artıq hərbçilərə deyil, əsasən din xadimlərinə, alimlərə və inzibati işçilərə bağışlanırdı (daha ətraflı *bax: И.П.Петрушевский. Очерки, с.145-183; О.А.Эфендиев. Институт «сойургал» и централистическая политика правителей Аккоюнлу и первых Сефевидов // Формы феодальной земельной собственности и владения на Ближнем и Среднем Востоке. Москва, 1979, с.168-175*).

### Rum diyarında baş vermiş hadisələr haqqında söhbət

Bu il Rum padşahı Sultan Məhəmməd ordu və yaraqla Əflaq diyarına yönəldi və Tuna (Dunay) çayı kənarında dayandı. Yergög qalasını[541] təmir etdi. Qasım bəy İsfəndiyaroğlunu igidlik meydanının bahadırlarından ibarət bir dəstə ilə kafirlər diyarına basqın etməyə göndərdi. Əflaq hakimləri iş bacaran elçilərini bol peşkəşlə o yüksək şanlı padşahın dərgahına göndərib üzrxahlıq və bağışlanmaq xahişi ilə ağız açdılar. Ərz etdilər ki, "bizim nə həddimiz var ki, sultana qarşı müxaliflik edək?!"

Şeir

"Hələ sən atanın belində olarkən, sənin qılıncının xəyalı,
Dövlət və din düşmənlərini ortadan ikiyə bölərdi.
Sənin nizən zəmanə həşəratlarını udub yeyər,
Necə ki, Kəlimin[542] əsası cadugərlərin cadusunu udmuşdu".

Ona görə də Sultan Məhəmməd onların təqsirlərindən keçib o diyardan döndü və Samsun[543] qalasını fəth etdi. O əsnada Amasya şəhərində olan oğlu Sultan Murad İskilibə[544] yönəldi, [Elxani hökmdarı] Sultan Əbu-Səid Bahadır xan zamanından orada qalmış moğol və tatar camaatını köçürüb Rumeliyə apardı və onları Məhəmməd bəy Minnətoğluya tapşırdı.

Həmçinin bu il Börklücə Mustafa adlı bir şəxs peyğəmbərlik iddiasına düşdü və bir dəstə avam camaat onun dərgahına toplaşdı. O, Aydın[545] diyarını ələ keçirdi və adamlarının sayı təqribən üç min nəfərə çatdı.

Bu xəbər Sultan Məhəmmədə çatdıqda oğlu Sultan Muradı və Bayəzid paşanı daş ürəkli bir ordu ilə o yoldan çıxmış azğını dəf etməyə göndərdi. Onlar çoxlu döyüşdən sonra o bədbəxt yaramaza qalib gəldilər və Qaraburnu (Qaraburun)[546] mövqeyində onu bütün mürtədlərlə birlikdə qətlə yetirdilər. Bayəzid paşa bir dəstə igidlə Manisaya[547] gəldi. Orada bir dəstə yəhudi ilə birlikdə müxaliflik edən Kamal adlı bir yəhudini qətlə yetirdi.

Həmçinin bu il Simavna qazısının oğlu[548] hakimiyyət (səltənət) iddiasına düşdü. Sultan Məhəmməd onu dəf etmək üçün çoxlu qoşun göndərdi. Onlar onu Seresdə[549] tutub [sultanın] dərgahına göndərdilər və Mövlana Xəlilin fitvası ilə öldürüldü.

Həmçinin bu il Sultan Məhəmməd Bursada ali bir imarət tikdirdi və Ədirnə şəhərini paytaxt (darülmülk) etdi. Bundan əvvəl isə Osmanlı (Ali-Osman) padşahları Bursada qışlaq edirdilər.

## 824-CÜ İLDƏ (1421) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Misir padşahı Sultan Əşrəfin Diyarbəkrə qoşun göndərməsi

Bu il Misir padşahı Sultan Əşrəf öz böyük əmirlərindən olan Tanrıvermişi altı minbaşı ilə Diyarbəkrə göndərdi. Onlar Hələbdən keçib Birəyə[550] çatdılar və Fərat çayı üzərində körpü bağlayıb suyu adladılar. Ruha (Urfa) qalasına yönəldilər. O əsnada bir dəstə cəsur cavanla orada yerləşmiş Qara Osman Bayandurun oğlu Habil bəy qaladan çıxıb döyüşə və vuruşa hazırlaşdı. Misirlilər bir həmlədə onu məğlub etdilər. Habil bəy qalaya sığındı.

---

[541] Tehran nəşrində Bərkuk yazılmış, M.Öztürk tərəfindən *(Ankara nəşri, s.147)* Yergög şəklində düzəliş verilmişdir. Yergög (Yergögü) qalası – Bolqarıstanın şimalında, Dunay çayı sahilində, Rusçuk (Ruse) şəhəri yaxınlığında yerləşir.
[542] Kəlim – Musa peyğəmbər.
[543] Samsun – Türkiyənin Qara dəniz sahilində şəhər.
[544] İskilib (İskilip) – Türkiyənin Çorum vilayətinin bir ilçəsi.
[545] Aydın – Türkiyənin cənub-qərbində, Egey dənizi sahillərində vilayət.
[546] Qaraburun – Türkiyənin İzmir vilayətində bir ilçə.
[547] Manisa – İzmirdən şimal-şərqdə şəhər.
[548] Osmanlı şeyxlərindən olan Şeyx Bədrəddin Mahmud nəzərdə tutulur. Börklücə Mustafa və Torlaq Kamal onun müridləri olmuşlar *(Nəvai, şərhlər, s.259)*. Simavna – Ədirnə yaxınlığında yerləşən və hazırda Yunanıstanın tərkibində olan bir kənddir.
[549] Seres (Serez) – Yunanıstanın Orta Makedoniya bölgəsində bir şəhərdir.
[550] Birə (Birəcik) – Türkiyənin cənub-şərq bölgəsində, Şanlıurfa ilə Qaziantep arasında, Fərat çayı sahilində şəhər.

O zaman Qara Osman Urumsaray[551] yaylağında idi. O, bu xoşagəlməz xəbəri eşitdikdə çoxlu ordu ilə misirlilərin üzərinə yollandı. [Misir] qoşunu Qara Osmanın gəlişindən xəbər tutduqda qalaya hücum etdi və qalanın ətəyində yerləşən Ruhanın köhnə hasarını aldı. Qara Osmanın oğlu Habil bəyin ürəyini tamamilə qorxu bürüdü. O, yaxşı danışıq qabiliyyətinə malik elçilərini bol peşkəşlə misirlilərin yanına göndərib aman istədi. Əhd-peyman bağlandıqdan sonra o, qaladan çıxdı. Qulamlar onu tutub mülazimlərini gedər-gəlməzə göndərdilər. Habil bəyi isə özləri ilə Misirə apardılar.

**Ölümlər**

Bu il Bəsrə[552], Vasit və Şüştər hakimi Sultan Üveys ibn Şahvələd ibn Şeyx Əli ibn Sultan Üveys İlkani Bağdada qoşun çəkdi. O zaman Şahrux sultanın qorxusundan fərar edərək Şah Məhəmmədin yanına Bağdada getmiş Cahanşah Türkman onu dəf etməyə tələsdi. Onların arasında böyük bir müharibə baş verdi. Çoxlu döyüşdən və vuruşdan sonra Sultan Üveys əsir tutulub qətlə yetirildi.

Bu il Uluğbəy Səmərqənd şəhərinin ortasında ali bir mədrəsə bina etdirdi, oraya çoxlu mülk vəqf etdi və rəsəd (rəsədxana) tikdirdi.

Həmçinin bu il Sufi-oğlan, Büraqın yanına gəlib çoxlu mallar gətirdi. O zaman Şir Məhəmməd-oğlan və Sarıq-oğlan qələbəlik bir dəstə ilə Cətədən[553] fərar edib Səmərqənd ətrafına gəldilər. Ona görə də Mirzə Uluğ bəy bir dəstə bahadırla onların üstünə gəlib, onları tutaraq geri döndü və Şir Məhəmməd-oğlana hörmət göstərib onu Cətəyə yolladı.

**825-Cİ İLDƏ (26.12.1421 – 14.12.1422) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT**

Bu il Azərbaycandan Dəli Əhməd Türkman xeyli ordu ilə Sultaniyyəyə gəlib, o şəhəri qarət edərək qənimətləri Təbrizə göndərdi. Dəli Əhmədlə Xoca İlyasın mülazimləri arasında gərgin bir döyüş baş verdi. Dava-dalaşdan sonra Dəli Əhməd məğlub oldu və onun əksər mülazimləri öldürüldü. O, qohum-əqrəbasız qalıb çoxlu məşəqqətlə Azərbaycana qaçdı.

Həmçinin bu il Şahrux padşahın oğlu Mirzə İbrahim düşməni məhv edən bahadırlarla hərəkət bayrağını Xuzistana doğru qaldırdı. O diyarın valisi olan Sultan Mahmud ibn Şahvələd ibn Şeyx Əli ibn Sultan Üveys İlkani ərəb diyarı tərəfə qaçdı. Mirzə İbrahim sultan o diyarı ələ keçirdi.

Bu il Şahrux padşahın Xətaya getmiş elçiləri Herata gəldilər. Onların getməsinin təfsilatı belədir[554]:

Zilqədə [ayının] 16-da (04.12.1419) darüssəltənə Heratdan çıxdılar və zilhiccə [ayının] 9-da (27.12.1419) Bəlxə çatdılar. 823-cü ilin məhərrəm [ayının] başlanğıcına (17.01.1420) qədər yağıntı və soyuq səbəbindən orada qaldılar. Ondan sonra köç edib, məhərrəm [ayının] 22-də (07.02.1420) Səmərqəndə yetişdilər. Onlar oraya çatmazdan iki ay öncə böyük əmir Uluğ bəy Kürəkan öz elçiləri Sultanşahı və Məhəmməd Bəxşini getməkdə olan xətaylılar camaatı ilə birlikdə göndərmişdi. Eyni zamanda, Əmirzadə Süyurqatmışın Ərğudaq adlı elçisi, Əmir Şahməlikin Ərdüvan adlı elçisi, Bədəxşan şahının Xoca Tacəddin adlı elçisi toplaşdılar və səfər [ayının] 10-da (25.02.1420) Xətay elçiləri ilə birlikdə darüssəltənə Səmərqənddən yola düşdülər. Rəbiüləvvəl [ayının] 4-də (19.03.1420) Daşkəndə, 11-də (26.03.1420) isə Seyrama çatdılar. Rəbiüssani [ayının] başlanğıcında (15.04.1420) Moğol elinə daxil oldular. Orada gözəl çəmənlər vardı və bahar fəsli idi. Hər gün köç edirdilər. Qəflətən xəbər gəldi ki, Üveys xan, Şir Məhəmməd-oğlanı qətlə yetirmək üçün çağırmışdır, Qul Məhəmmədlə bəzi moğol əmirləri bu səbəbdən Üveys xana yağı (düşmən) olmuşlar və el bir-birinə dəymişdir. Elçilər qorxuya düşdülər və köç etdilər. Ondan sonra xəbər gəldi ki, o fitnə yatmışdır və

[551] Urumsaray – Ərzincanın şimalında bir kənd olub, indiki adı Məcidiyyədir *(Öztürk, şərhlər, s.149).*

[552] Bəsrə – İraqın cənubunda, Dəclə və Fərat çaylarının qovuşduğu Şəttülərəb çayı üzərində mühüm liman şəhəri. Vasit – İraqda, Bağdadla Bəsrə arasında, Dəclə çayı hövzəsində bir vilayətdir.

[553] Cətə – Monqolustandadır *(Nəvai, şərhlər, s.311).*

[554] Həmin elçilik heyətinin tərkibində olan Mövlana Qiyasəddin Naqqaş bu barədə bir səyahətnamə qələmə almışdır. Onun səyahətnaməsi daha sonra Teymuri tarixçilərindən Hafiz Əbrunun "Zübdətüt-təvarix" və Əbdürrəzzaq Səmərqəndinin "Mətləüs-səədeyn" əsərlərinə daxil edilmişdir. Ağqoyunlu dövründə, h. 900 / m. 1494-95-ci ildə Ərdistan daruğası Zeynəddin Nurəli bəy Mahmudlunun əmri ilə Hacı ibn Məhəmməd Ərdistanlu tərəfindən farscadan türkcəyə tərcümə edilmişdi *(Ш.Мустафаев. Тимуридское посольство в Китай и его описание на азербайджанском языке согласно рукописи XV в. // Известия НАН Азербайджана. Серия общественных наук. Баку, 2015, № 3, с.98-115).* Həsən bəy Rumlu bu səyahətnamənin farsca mətnini, güman ki, Teymuri salnamələrindən əxz etmişdir.

əmirlər Üveys xanla sülh etmişlər. O diyarın mötəbər əmiri olan Əmir Xudadad gəlib çatdı və elçilərə hörmət göstərib Üveys xanın yanına getdi.

Elçilər əmin olub öz yolları ilə getdilər. Cəmadiyüləvvəl [ayının] 18-də (31.05.1420) Bilğutu deyilən və Məhəmməd bəyin eli (ərazisi) hesab edilən yerə çatdılar. Orada Bədəxşan şahının tacirlərindən və elçilərindən bəzilərinin və Xətaya gedən başqa şəxslərin hamısının gəlib çatması üçün bir qədər gözlədilər. Cəmadiyüləvvəl [ayının] 21-də (03.06.1420) oradan köç etdilər və [ayın] 22-də (04.06.1420) Kəngər çayından keçdilər. [Ayın] 23-də (05.06.1420) elçilər bu ulusun hakimi olan Məhəmməd bəyi gördülər. Məhəmməd bəyin oğlu Sultan Şadi cahan şahının (şahi-cahan) kürəkəni idi. Onun xatunu böyük əmirzadə Cuki Bahadırın xatununun bacısı idi. Cəmadiyüləvvəl [ayının] 28-də (10.06.1420) Yılduz çəməninə və vadisinə gəldilər. Oradan da Şir Bəhramın elinə getdilər. Günəş Xərçəng bürcünə çatsa da, su buz bağlamışdı. Belə ki, [su] iki barmaq qalınlığında buzla örtülmüşdü.

Cəmadiüssani [ayının] 8-də (20.06.1420) xəbər çatdı ki, Məhəmməd bəyin oğulları Üveys xanın elçisi ilə yoldaş olan bir taciri qarət etmişlər. Tacirlər və elçilər vahiməyə düşdülər və dedilər:

- Biz gərək səy göstərək ki, tezliklə özümüzü Xətay sərhədinə çatdıraq.

Yolda sərt dağlar vardı. Əksər vaxtlarda yağış və dolu yağırdı. Cəmadiülaxır [ayının] (13.06-11.07.1420) axırında Turfan şəhərinə[555] çatdılar. Bu şəhərdə əksəriyyət bütpərəst idi və çox ehtişamlı və böyük bir bütxana vardı. Orada çoxlu bütlər qoyulmuşdu. Bəzilərini yeni düzəltmişdilər və bəziləri köhnə idi. Səfin ən qabağında böyük bir büt vardı. Deyirdilər ki, bu, Sakemuninin[556] heykəlidir.

Rəcəb [ayının] 2-də (13.07.1420) köç etdilər və hava olduqca isti idi. Rəcəb [ayının] 5-də (16.07.1420) Qara-Xocaya[557] çatdılar. [Ayın] 10-da (21.07.1420) bir dəstə xətaylı gəlib çatdı və dedilər ki, elçilərin adlarını və onların sayını yazsınlar. Rəcəb [ayının] 19-da (30.07.1420) Ata-Sufi deyilən yerə çatdılar. Termez[558] seyidlərindən olan Tacəddin adlı birisi orada təkyə qurub məskunlaşmışdı. O, Qumul[559] müsəlmanlarının hakimi Əmir Fəxrəddinin kürəkəni idi. Rəcəb [ayının] 21-də (01.08.1420) Qumul şəhərinə çatdılar. Bu şəhərdə Əmir Fəxrəddin böyük bir məscid tikdirmişdi. Məscidin qarşısında olduqca böyük bir bütxana tikmişdilər. Orada böyük bir büt düzəltmişdilər və onun sağında, solunda çoxlu kiçik bütlər vardı. Böyük bütün önündə on yaşlı bir uşağın misdən çox sənətkarlıqla və gözəl bir şəkildə heykəlini düzəltmişdilər. Evin divarlarının üzünə ustalıqla rəsmlər çəkmişdilər və gözəl rənglərlə boyamışdılar. Bütxananın qapısı üzərinə bir-birinə həmlə edən iki divin surətini çəkmişdilər. Mengli Teymur Baburi Qumul hakimi idi. O, hüsn-camal sahibi olan bir cavan idi.

Rəcəb [ayının] 25-də (05.08.1420) oradan köç etdilər və ondan sonra yolun çox hissəsi çöl idi. Hər bir-iki gündən bir suya (çaya) çatırdılar.

Şaban [ayının] 12-də (22.08.1420) elə bir mövqeyə çatdılar ki, orada səhra dəvələri və çöl öküzləri çox idi. Oranın çöl öküzləri çox böyük olurlar. Oranın camaatı söyləyirdi ki, bir dəfə bir öküz bir süvariyə həmlə etmiş və süvariyə buynuzunu sancıb onu yəhərin üzərindən qaldırmışdı. O şəxs ölmüş və bir müddət beləcə [öküzün] buynuzunda qalmışdı. Axırda onun yağı öküzün gözünə axmış və [öküz] kor olmuşdu.

Şaban [ayının] 14-də (24.08.1420) elə bir yerə çatdılar ki, oradan xətaylıların ilk şəhəri olan və onların qaravulları yerləşən Səkcuya[560] qədər çöllə on günlük yol vardı. Bir dəstə xətaylı, padşahın hökmünə uyğun olaraq, elçiləri qarşılamağa gəlmişdilər. Orada gözəl bir çəmənlik vardı. O çəmənlikdə ali bir platforma (qaldırım) düzəltdilər, bez kölgəliklər (sayəbanlar) qurdular, ayaqlı sinilər və səndəlilər qoydular. Qazdan, toyuqdan, bişmiş ətdən, yemişlərdən, quru və təzə meyvələrdən ibarət növbənöv qidaları çini tabaqlara düzdülər və hər siniyə süni gül budağı bağladılar.

Xülasə, o biyabanda elə bir möhtəşəm ziyafət ("toy") təşkil etdilər ki, beləsini heç şəhərlərdə də tərtib etmək olmazdı. Göyərtilər qoymuş, süfrələr açmışdılar. Yeməkdən sonra araq və şərabdan ibarət növbə-

---

[555] Şərqi Türküstanda yerləşən bu şəhər manixeyizmin önəmli mərkəzlərindən idi *(Öztürk, şərhlər, s.151).*

[556] Sakemuni – Buddanın ləqəblərindən biridir.

[557] H. 800 / m. 1397-98-ci ildə qırğızlar tərəfindən süquta uğradılmış Uyğur xanlığının ümdə şəhərlərindən biri idi *(Nəvai, şərhlər, s.266).*

[558] Termez – Özbəkistanın Əfqanıstanla sərhədində şəhər.

[559] Şərqi Türküstanda şəhər.

[560] Səkcu – Çinin Kansu əyalətinin Suçsu (Sou-Tcheou) şəhəri nəzərdə tutulur *(Nəvai, şərhlər, s.267).*

növ içkilər gətirdilər və hamını məst etdilər. Ziyafətdən başqa, hər kəsə öz dərəcəsinə görə qoyun, un, arpa, səfər ehtiyacları, araq və şərab verdilər və bütün bunların hamısını Səkcudan gətirmişdilər. Orada qeydiyyata aldılar ki, hər kəsin yanında nə qədər nökər vardır. Tacirlərdən iltizam aldılar ki, gərək artıq sayda nökər yazmasınlar. Çünki Xətay qayda-qanunu (yasaq) çox dəqiqdir. Kim yalan söyləsə, onun etibarı qalmaz. Tacirlərin çoxusu elçilərin yanında nökər olub xidmət etdilər.

Xülasə, bu təfsilatla yazdılar: Əmir Şadi və Xoca Gögcə - 220 nəfər; Sultan Əhməd və Xoca Qiyasəddin – 150 nəfər; Ərğudaq – 60 nəfər; Ərdüvan – 50 nəfər; Bədəxşan şahının nökəri Xoca Tacəddin – 50 nəfər. Böyük əmirzadə Uluğ bəy Kürəkanın nökərləri daha öncə getmişdilər. Əmirzadə İbrahimin nökərləri isə hələ gəlib çatmamışdılar.

Şaban [ayının] 16-da (26.08.1420) elçilərə xəbər etdilər ki, bu gün Vank Daci şahanə ziyafət verəcəkdir. Həmin bu Vank Daci Xətay padşahı tərəfindən Qumul səmtində yerləşən o sərhədin hakimi idi və Səkcudan onun şəhərinədək doqquz yam (poçt mənzili) məsafə vardı. O, beş-altı minlik qoşunla elçiləri qarşılamağa gəlmişdi. Elçilərin hamısı atlara mindilər və Vank Dacinin yurdunun (düşərgəsinin) yaxınlığına gəldilər.

Onların səhrada yerbəyer olması qaydası belə oldu ki, əsgərlər pərgar və xətkeş kimi düz xətt boyunca dördbucaq şəklində yerləşdilər. Çadırların iplərini bir-birinə elə bağladılar ki, piyadanın oradan içəri keçməsi üçün heç bir yol qalmadı. O dördbucağın dörd tərəfində dörd darvaza qoydular və onların aralarındakı məsafə böyük idi. Bu dördbucağın ortasında bir cərib[561] miqdarında böyük bir platforma düzəltdilər və böyük bir çadır qurdular. Onun qarşısına iki Xətay nizəsi vurdular. Şahın oturduğu yer kimi orada taxtadan bir talvar düzəldib bez kölgəliklər qurdular. Beləliklə, o bir cərib ərazi bütövlüklə kölgəlik oldu. Talvarın altına Vank Dacinin səndəlisini, soldan və sağdan da digər səndəliləri qoydular. Belə ki, sol tərəfdə elçilər oturdular və sağ tərəfdə Xətay əmirləri. Onların arasında sol tərəf sağ tərəfə nisbətən daha hörmətli yer sayılır. Ondan sonra elçilərdən və əmirlərdən hər birinin qarşısına iki ədəd ayaqlı sini qoydular: birində əlvan nemətlər, quru Xətay meyvələri, toyuq, qaz, düyü və bişmiş ət, digərində isə şirin qoğallar, yaxşı çörəklər və kağızla ipəkdən düzəldilən, izah edilməyəcək dərəcədə gözəl olan süni güllər vardı. Digər adamların qarşısına bir ədəd ayaqlı sini, çox böyük bir kurkə[562], çini küplər və küpçələr, irili-xırdalı çini və gümüş sürahilər qoymuşdular. Kurkənin böyründə soldan və sağdan bir dəstə mütrüb dayanmışdı. Yatuğan[563], Xətay kamançası, birisi başdan, digəri isə yandan üfürülən iki növ ney, Xətay tönbəki, musiqar[564], sepayə (üçayaqlı) üzərinə qoyulmuş ikiüzlü təbil öz üsuluna görə çalınırdı. Onların yanında sinc və çaharpayə (dördayaqlı) üzərinə qoyulmuş dühül[565] vardı və oyunçular (bazigəran) ayaq üstə dayanmışdılar. Yaraşıqlı oğlanlar qırmızı və ağ rəngə boyanmışdılar. Hər kəs görsəydi deyərdi ki, qızdırlar. Başlarında külahlar, qulaqlarında mirvaridlər vardı. Onlar Xətaya məxsus elə oyunlar göstərirdilər ki, bunların misli dünyanın heç yerində yoxdur. O platformanın önündən ta dörd darvazaya qədər ki çadırlar qurmuşdular, cəbbə (əsləhə) geymiş adamlar əllərində uzun nizələrlə ayaqları tərpənməz şəkildə dayanmışdılar. Onların başının üstündə bir yasavulun[566] dayanmasına ehtiyac yox idi. Çünki səhlənkarlıq edəcəkləri təqdirdə onlara veriləcək cəzanı sözlə təsvir etmək mümkün deyildir.

Adamları münasib yerlərdə əyləşdirdikdən sonra onlara kasa və piyalə verdilər və yeyib-içdilər. Divanı idarə edən Miri-Dusun (divan əmiri) ayağa qalxdı və kasa payladı. Onun yanında süni güllərlə dolu sandıq aparırdılar. O, hər kəsə kasa verdi və bir şaxça süni gülü onun başına və sarığına taxdı. Beləliklə, bir saat içində məclisi gülüstana çevirdi.

Ondan sonra oyunçular onun buyruğu ilə elə oyunlar göstərdilər ki, onların şərhini yazmaq mümkün deyildir. O cümlədən aləmdə ad salmış hər heyvanın müqəvva kağızından düzəldilmiş surətlərini (maskaları-

---

561 Cərib – eni və uzunu 60 arşın olan yer ölçüsü.

562 Kurkə – böyük təbil deməkdir, zərb musiqisi alətlərindəndir. Bu söz əski türk kəlməsidir və əslində "kurka" kimi səslənir *(M.Müin. Fərhəngi-farsi. III c. Tehran, 1345, s.3121).*

563 Yatuğan (yatağan) – İranda santur adı ilə tanınan musiqi alətidir *(Nəvai, şərhlər, s.270).*

564 Tönbək (dümbək) – zərb alətidir; musiqar – qədim nəfəs alətlərindəndir *(A.İ.Nəcəfzadə. Azərbaycan idiofonlu çalğı alətləri. Bakı, 2010, s.95).*

565 Dühül – zərb çalğı alətidir.

566 Yasavul istilahı "qanun" və "fərman" mənası verən "yasa" sözündən götürülüb və bu vəzifənin daşıyıcıları hökmdarın hüzurunda əmr və fərmanları icra edən şəxslər idilər.

nı) üzlərinə taxdılar. Belə ki, onların qulaqlarının ucundan və üzlərindən heç bir parça belə görünmürdü. Sanki o maska deyildi, həmin heyvanın özü idi. Onlar o surətləri taxıb gəzirdilər və xətaylıların üsulu ilə rəqs edirdilər. Belə ki, ağıl buna heyran və məəttəl qalırdı. Günəş üzlü digər oğlanlar da əllərində sürahilər və piyalələrlə dayanmışdılar. Bəziləri əllərində fındıqdan, innabdan, qozdan, təmizlənmiş şabalıtdan, limondan, sirkə ilə isladılmış sarımsaq və soğandan və Xətayda olan, bu tərəflərdə isə olmayan, heç kəsin görmədiyi, adını eşitmədiyi tərəvəzlərdən, kəsilmş qarpızdan, qovundan ibarət çərəz tabaqları tutmuşdular. Bunların hamısını bir tabağa xana-xana düzmüş və hər birini orada ayrı-ayrı yerləşdirmişdilər. Hansısa bir əmir kasa götürdüyü zaman dərhal həmin oğlan irəli gəlir və tabaqları ona tərəf uzadırdı ki, meylinin çəkdiyi çərəzi oradan götürsün.

Bundan başqa, bezdən bir leylək düzəltmişdilər, ona lələklər və qanadlar taxmışdılar, onun dimdiyini və ayağını qırmızı etmişdilər. Beləliklə, o, mütləq surətdə leyləyə oxşayırdı. Amma daha böyük idi. Bir oğlan həmin surətin içinə girib gəzirdi və özünün hər tərəfini örtmüşdü. O, eynən leyləyə bənzəyirdi və xətaylıların çaldıqları nəğməyə uyğun şəkildə ayağını yerə döyür, başını bu tərəfə, o tərəfə döndərirdi. Orada olanların hamısı ona heyran qalmışdı.

Uzun sözün qısası, o gün axıra kimi bu minvalla vaxt keçirdilər. Onlar bütün bu tədarükləri çöldə uzanıb gedən on günlük yolla elçiləri qarşılamaq üçün gətirib gəlmişdilər.

Şaban [ayının] 17-də (27.08.1420) oradan köç edib çölə daxil oldular və nəhayət, qaravul məntəqəsinə çatdılar. Bu qaravul məntəqəsi möhkəm bir qaladan ibarət idi və ətrafına dərin bir xəndək çəkilmişdi. Yol iki qalanın arasından keçirdi və onun ətrafı tamamilə yolu olmayan dağlar idi. Bu qaladan çıxdıqdan sonra digər qalaya getmək lazım idi. Elə ki qalaya daxil oldular, adamların adlarını yazmayınca, o qaladan digər qalaya getmələrinə izin vermədilər.

Qaravul məntəqəsindən keçdikdən sonra Səkcu şəhərinə çatdılar. O şəhərdə böyük bir poçt binası (yamxana) vardı. Hamı o yamxanada endi və elçilərə dedilər:

- Burada enin! Çünki bu vilayətin qaydası belədir. Bundan belə hər nəyə ehtiyacınız olsa, hamısı yamxanadan veriləcək.

Onların heyvanlarını və yüklərini alıb hamısını dəftərə yazdılar və etibarlı adamlara tapşırdılar. Ondan sonra elçilərin minikdən və döşəkdən hər nə ehtiyacı varsa, hamısını yamxanadan təmin etdilər və hər gecə onların sayına uyğun olaraq, hər birinə bir çarpayı və ipəkdən bir dəst yataq paltarı ilə buyruqlarını yerinə yetirmək üçün bir xidmətçi təyin etdilər.

Bu Səkcu çox böyük bir şəhər idi və möhkəm bir qalası vardı. Şəhərin vəziyyəti dördbucaq şəklində idi. Elə bil ki, xətkeş və pərgarla çəkmişdilər onu. Bazarın ortasında əlli şəri gəz[567] miqdarında genişlik vardı. Oranın hər yerinə su vurub süpürgə çəkmişdilər. Elə təmiz idi ki, əgər yerə yağ dağılsaydı, onu toplamaq mümkün olardı. Onların evlərində çoxlu əhliləşdirilmiş donuz vardı. Dükanda qəssablar qoyun və donuz ətini bir-birinin yanında asmışdılar. Dükanlarda müxtəlif sənət əşyaları qoymuşdular. Onların çox sayda dörd girişli bazarları vardı və hər dörd girişin başında taxtadan bər-bəzəkli və olduqca ehtişamlı bir tağ düzəltmiş, ona taxta küngürələr taxmış və naxışlı Xətay günbəzləri bağlamışdılar. Şəhərin qala divarlarında hər iyirmi addımdan bir üstü bağlı bürc düzəltmişdilər. [Qala divarları] o qədər düz idi ki, bu darvazadan o birinə çatmaq yaxın görünürdü. Amma əslində isə yol uzun idi. Hər darvazanın arxasında Xətay üsulu ilə iki mərtəbəli köşk düzəltmişdilər. Onlar da Mazandaranda olduğu kimi imarətlərin başını dik qübbəli edirlər. Amma fərq bundadır ki, Mazandaranda bunu rəngsiz kirəmitdən edirlər, xətaylılar isə onu əksər hallarda çini kasadan düzəldirlər.

Bu şəhərdə çoxlu bütxana vardı. Hər biri təxminən on cərib miqdarında idi. Onların bütün zəmini bişmiş və yonulmuş kərpiclə döşənmişdi. Onların bişmiş kərpici cövhər daşı kimidir və möhkəmdir. Bütxanaları elə təmiz saxlayırlar ki, qətiyyən heç bir natəmizlik tapmaq mümkün deyildir. Bütxananın qapısında yaraşıqlı oğlanlar dayanıb qərib adamlara yol göstərirlər. Onların çatdıqları bu şəhər padşah[568] divanının hökmündə olan ilk şəhər idi. Oradan padşahın paytaxtı olan Xanbalığa[569] doxsan doqquz poçt mənzili (yam) mə-

---

[567] Gəz (şəri gəz) – təxminən 3 futa bərabər uzunluq vahidi.
[568] Çin padşahı nəzərdə tutulur.
[569] Xanbalıq – Pekin.

safə vardı və onların hamısı abad idi. Hər bir yam bir şəhərin və qəsəbənin yanında yerləşirdi. Yamların arasında neçə qarğu və kiydi-fu vardı. Qarğu altmış gəz hündürlüyü olan bir evdir və daim on nəfər keşik çəkmək üçün bu evdə qalır. Əlbəttə, oranı elə düzəldiblər ki, o biri qarğu oradan görünür. Əgər qəflətən bir hadisə baş versə, məsələn, yadlar qoşun çəksə, sərhəddə olan məntəqədən dərhal atəş yandırarlar və o biri qarğu atəşin əlamətini görən kimi o da belə bir atəş yandırar. Beləliklə, bir gecə və gündüz ərzində üç aylıq yol məsafəsində olanlar bilərlər ki, nə isə olmuşdur. O atəşin ardınca isə baş vermiş hadisə haqqında məktub yazarlar və kiydi-fular vasitəsilə bir-birinin əlinə çatdırarlar. Kiydi-fu bir neçə ailədən ibarətdir ki, bir yerdə sakin olmuşlar. Onların vəzifəsi və işi odur ki, bir xəbər çatdığı zaman növbətçi şəxs qalxıb, dərhal onu o biri kiydi-fuya yetirməlidir. Həmçinin o da digərinə çatdırmalıdır ki, bu minvalla [xəbər] paytaxta yetişsin. Bir kiydi-fudan digərinə qədər on mərrə məsafə var və hər on altı mərrə bir şəri fərsəxə bərabərdir. Qarğuda yerləşdirilən camaat növbə ilə xidmət edir. On gün keçdikdən sonra onlar gedərlər və onların əvəzinə on adam növbə çəkməyə gələr. Amma kiydi-fuda olan camaat orada sakindirlər, evlər tikmişlər, təsərrüfata malikdirlər və əkinçiliklə məşğul olurlar. Onların işi odur ki, əgər bir xəbər çatsa, onu digər kiydi-fuya yetirsinlər.

Səkcudan böyük bir şəhər olan Qəmcuya[570] qədər doqquz yam [məsafə] vardı. Qəmcu Səkcudan çox böyük və daha abad bir şəhərdir. Sərhəd hakimlərinin (dacilərinin) ən böyüyü olan Vank Daci o şəhərdə hakimlik edirdi. Səltənət şüarlı həzrətin (Şahruxun) və onun oğullarının hüzurundan getmiş bu elçilər üçün hər yamda dörd yüz əlli at və yorğa uzunqulaq, əlli-altmış araba gətirmişdilər. Atlara baxan oğlanlara “bafu”, uzunqulaqlara baxanlara “lufu”, araba çəkənlərə isə “cinu” deyirdilər və onların sayı çox idi. Ona görə ki, arabalara kəndirlər bağlamışdılar və onu həmin oğlanlar çiyinlərinə bağlayaraq dartıb aparırdılar. Əgər qarşılarına yağıntı və dağ çıxsaydı, oğlanlar öz çiyinlərinə güc verərək o arabaları bir yamdan digər yama çatdırırdılar. Hər arabanı on iki nəfər çəkirdi. Oğlanların hamısı xoş görkəmli idi, qulaqlarında yalançı Xətay mirvaridləri vardı və saçlarını başlarının ortasında düyünləmişdilər. Gətirdikləri atlar yəhərli, yüyənli və qamçılı idi. Bu bafular ta digər yama qədər cilovun başında yürüyərlər. Necə ki, peyklər (qasidlər) bu diyarda təəssüblə yürüyərlər. Hər yamda təyin olunduğu miqdarda qoyun, qaz, toyuq, düyü, un, bal, şərab, araq, sirkədə isladılmış sarımsaq və soğan, göyərti, sirkəyə batırılmış tərəvəz çeşidləri və bundan başqa ehtiyaclar yamxanalarda tədarük edilmişdi. Hansı şəhərə çatırdılarsa, elçilərə ziyafət verirdilər. Onlar divanxanaya “dusun” deyirlər. Hansı dusunda ziyafət verirdilərsə, əvvəlcə üzü onların padşahının paytaxtı olan Xanbalığa sarı yerləşdirilmiş kurkənin önündə bir taxt qoyardılar və onun üzərindən taxtın yan tərəfinə bir pərdə asardılar. Bir şəxs taxtın yanında dayandı və böyük, təmiz bir keçəni taxtın böyründən asdı. Böyük əmirlərə və elçilərə o taxtın yanında yer verdilər. Digər adamları isə onların arxasında sıraladılar. Taxtın yanında dayanmış şəxs Xətay dilində üç dəfə bir nida söylədi. Ondan sonra dacilər başlarını yerə qoydular. Elçilərə və başqa adamlara da təklif etdilər ki, başlarını yerə qoysunlar. Sıralar elə düzgün dayanmışdı ki, lap müsəlmanların namaza dayanmasına bənzəyirdi. Baş qoyduqdan sonra hər kəs özü üçün qoyulmuş ayaqlı sinilərin yanına getdi.

Həmin gün Vank Daci Qəmcuda elçilərə ziyafət verdi. Ramazanın 12-si (20.09.1420) idi. Elçilərdən xahiş etdi ki, “bu, padşahın ziyafətidir; padşah sizi əziz tutmuşdur və bir şey yeyin”. Şadi Xoca və elçilərin böyüklərindən olan kimsələr də xahiş etdilər ki, “dinimizdə rəva görülməyən şeyi bizə təklif etməyin”. Vank Daci onların üzrxahlığını qəbul etdi, ayaqlı siniləri və onlar üçün tərtib edilmiş şeyləri onların otağına göndərdi.

Bu Qəmcu şəhərində yetərincə böyük bir bütxana vardı. Belə ki, bütxananın əsl imarəti və ona daxil olan qisim beş yüz gəzin beş yüz gəzə ölçüsündə idi. Bu imarətin ortasında bir bütxana vardı. Onun içində yatmış bir büt düzəltmişdilər ki, o bütün uzunluğu əlli qədəm və ayağının pəncəsinin uzunluğu doqquz qədəm idi. Onun kəlləsinin çevrəsi iyirmi bir şəri gəzə bərabər idi. Onun ətrafında ehtişamlı imarətlər, arxasında və başının üzərində hər biri təxminən iyirmi gəz ölçüsündə digər bütlər vardı. Bəxşilərin (rahiblərin) surətinin hər biri bir adam boyunda idi. Elə ustalıqla düzəldilmişdilər ki, görənlər onların canlı olduqlarını zənn edirdilər. Digər divarların üzərinə elə rəsmlər çəkmişdilər ki, dünyanın bütün naqqaşları [onları gördükdə] heyrət barmaqlarını dişlərinin arasına qoysunlar. Bu böyük və yatmış büt bir əlini başının altına qoymuşdu və digər əlini budunun üzərinə qoymuşdu. Bu böyük bütün tamamını qızılı su ilə boyamışdılar və ona növbə-

[570] Qəmcu – Çinin Kansu əyalətinin cənub şəhərlərindən olan və Ning-Hia əyalətinin sərhədi yaxınlığında yerləşən Kan-Tsou şəhəridir *(Nəvai, şərhlər, s.275).*

növ rəngli libaslar geyindirmişdilər. Onun adına Sekemuni-Fu deyirlər. Dəstə-dəstə kafirlər gəlirlər və o bütün qarşısında başlarını yerə qoyurlar.

Bundan başqa, həmin imarətin bayırında karvansara otaqları kimi bir-birinin böyründə yerləşən, hər biri bir bütxana olan evlər vardı. Onlar müxtəlif zərbafta pərdələrə, qızılı kürsülərə, səndəlilərə, şamdanlara, çini sürahilərə və tam bər-bəzəyə malik idilər. Bu Qəmcuda on dənə belə müəzzəm bütxana vardı. Daha bir ev də tikmişdilər ki, müsəlmanlar oraya çərxi-fələk deyirdilər. Bu, səkkiz bucaqlı bir köşk şəklində olub, aşağıdan yuxarıya qədər on beş mərtəbədən ibarət idi. Onun hər təbəqəsində gözətçi yerləri düzəltmiş, hər gözətçi yerində Xətay üsullu bir qübbə qurmuş, gözətçi yerlərinin ətrafında otaqlar və eyvanlar tikmiş, cürbəcür surətlər yaratmışdılar. Məsələn, [bu təsvirlərin birində] taxtın üzərində oturmuş padşah və onun solunda və sağında dayanıb hər biri hansısa xidməti həyata keçirməklə məşğul olan xadimlər və qızlar [əksini tapmışdı]. Beləliklə, bir-birinin üzərində yüksələn bu on beş mərtəbədə bir qarışdan bir gəz uzunluğuna qədər kiçikli-böyüklü surətlər düzəltmişdilər və bunların tamamının altında bu köşkü çiyinlərində tutan divlərin heykəllərini düzəltmişdilər. O köşkün çevrəsi iyirmi gəz və hündürlüyü on iki gəz idi. Bu məcmunu taxtadan yonmuşdular, amma elə qızıla boyamışdılar ki, adam onun tamamilə qızıldan düzəldiyini təsəvvür edirdi. Onun altında bir sərdabə düzəltmişdilər və aşağıdan yuxarıyadək bir dəmir mil yerləşdirmişdilər, onun bir ucunu aşağıda dəmir kürsünün üzərinə qoymuşdular və digər ucunu o köşkün yerləşdiyi evin damına bərkitmişdilər. Belə ki, o sərdabədə bir balaca hərəkətlə bu cür əzəmətli köşk fırlanmağa başlayardı. Gərək dünyanın bütün dülgərləri, dəmirçiləri və naqqaşları onu seyr etsinlər və oradan sənət dərsi öyrənsinlər.

Bu yamlardan keçib şəhərlərə çatırdılar və Xanbalığa yaxınlaşdıqca elçilərə verilən ziyafətlər daha ehtişamlı olurdu. Elçilərin və onların nökərlərinin yüklərini və heyvanlarını bu Qəmcu şəhərində qoyub tapşırdılar ki, geri dönüş vaxtı tamam-kamal onlara təslim edilsin. Padşaha peşkəş olaraq gətirdikləri şeyləri də elçilərdən aldılar və onların dərd-qəmini dağıtdılar.

Bu minvalla hər gün bir yama və hər həftə bir şəhərə çatırdılar. Nəhayət, şəvval [ayının] 14-də (22.10.1420) Qaramun çayına[571] yetişdilər. O, təqribən Ceyhun qədər böyük bir çay idi. Olduqca gözəl və möhkəm gəmidən körpü (bərə) bağlamışdılar, adam budu yoğunluğunda olan əzəmətli bir dəmir zənciri çayın o tayından və bu tayından on gəz qədərincə quruya çıxmış şəkildə çəkmişdilər, hər iki tərəfdən hər biri adam beli yoğunluğunda olan mili yerə möhkəmlətmişdilər və həmin zənciriləri onlara bərkitmişdilər. Gəmilərin böyük qarmaqlarını o zəncirlərə bağlamışdılar. Orada iyirmi üç gəmi vardı. Gəmilərin üzərindən olduqca möhkəm və hamar taxtalar salmışdılar. Beləliklə, bütün heyvanlar zəhmətsiz şəkildə onun üzərindən keçirdilər.

Qaramun çayının o tayında böyük bir şəhər vardı. Elçilərə ziyafət verdilər. Bu ziyafət daha öncə verilən ziyafətlərdən daha möhtəşəm idi. Bu şəhərdə olduqca əzəmətli və görkəmli bir bütxana vardı. Belə ki, sərhəddən oraya qədər o imarətin tayı-bərabəri görünməmişdi. Oranın üç böyük xərabatı[572] vardı və onların içində gözəl qızlar vardı. Deyirdilər ki, bu qızlardan bəziləri hələ də bakirədirlər.

Bu şəhərdə çox dürüst əsnaflar və sənətkarlar vardı. Xətay əhalisinin əksəriyyəti hüsn-camal sahibi olsa da, məhz bu şəhərə "Hüsnabad" ("Gözəllik şəhəri") deyirdilər.

Oradan da çıxıb, bir neçə digər şəhərdən keçdilər. Nəhayət, zilqədə [ayının] 12-də (18.11.1420) Ceyhun çayının iki bərabəri qədər olan, böyük dalğalara malik bir çaya çatdılar[573]. Sonra gəmiləri hazır etdilər və hamı çaydan keçdi. Bir neçə başqa çaylardan da keçdilər, bəzilərindən gəmi ilə və bəzilərindən körpü ilə.

Zilqədə [ayının] 27-də (03.12.1420) Sedinfu[574] şəhərinə çatdılar. Ora da böyük bir şəhərdir. Çoxlu izdihama və yaxşı imarətlərə malikdir. O cümlədən orada əzəmətli bir bütxana var ki, onun ortasında bürüncdən tökülmüş bir büt düzəltmişlər və onu qızıl suyuna boyamışlar. Elə bil ki, o, tamamilə qızıldandır. Onun əlli zər[575] miqdarında hündürlüyü vardı və həmin heykəlin əzalarının hamısını münasib şəkildə düzəltmişdilər. Onun bütün əzalarına əl surəti çəkmişdilər və hər əlinin ovcuna bir göz surəti çəkmişdilər. Ona "min ələ

---

571 Qaramun (Qaramuran) çayı – Hvanq-hu çayı nəzərdə tutulur *(Nəvai, şərhlər, s.277).*
572 Xərabat – meyxana, içki içilən yer mənasındadır.
573 Bu çay da qıvrıla-qıvrıla axan, çoxlu qolları olan və Sarı dənizə tökülən Hvang-hu çayıdır *(Nəvai, şərhlər, s.277).*
574 Sedinfu – Çinin Singinfu şəhəridir *(Nəvai, şərhlər, s.278).*
575 Nuruosmaniyyə nüsxəsi: "əlli gəz". Zər – 107 sm-ə bərabər uzunluq vahidi.

malik büt" deyirdilər. Onun şöhrəti bütün Xətayı bürümüşdür. Əvvəla, yaxşı yonulmuş daşlardan böyük və möhkəm bir kürsü tikmişlər. Həmin kürsü bu bütü və ətrafındakı imarətləri öz üzərində saxlayır. Bundan başqa, bir neçə mərtəbədən ibarət çoxlu rəvaqlar, gözətçi yerləri və lojalar düzəltmişdilər: birinci mərtəbə onun ayaq dabanından keçmişdi; ikinci mərtəbə onun dizinə çatmamışdı; üçüncü mərtəbə onun dizindən keçmişdi; digəri onun belinə çatmışdı; daha bir [mərtəbə] sinəsinə qədər idi və bu minvalla [mərtəbələr] onun başına qədər davam edirdi. Bu tikililər möhtəşəm olub, ustalıqla inşa olunmuş və daha sonra o imarətin başı qübbə ilə örtülmüşdü. Onun üzərini elə örtmüşdülər ki, adamlar ona heyran qalırdılar. O, səkkiz mərtəbədən ibarət idi. Hər mərtəbənin həm bayır, həm də iç tərəfindən imarətin ətrafını dolaşmaq olardı. Bu bütü ayaq üstə dayanmış vəziyyətdə düzəltmişdilər. Onun hər biri təqribən on gəz olan iki ayağını iki incə sütun üzərində tökmüşdülər. Belə ki, bu sütunlar görünmədiyi üçün adama elə gəlirdi ki, o, boşluqda (havadan asılı vəziyyətdə) dayanmışdır. Həmçinin hesablamalara görə, bu iş üçün ən azından yüz min xərvar[576] bürünc xərclənmişdi.

Bundan əlavə, o bütün ətrafında əhəngdən (gipsdən) kiçik bütlər düzəltmiş, onları rəngləyib qızıla boyamışdılar. Dağların, yamacların, mağaraların rəsmlərini çəkmişdilər. Beləliklə, bəxşilər, ruhbanlar və cukilər (yəni bütpərəst rahiblər və zahidlər) orada çillədə oturmuşdular və əzab çəkirdilər. Yabanı qoç, dağ keçisi, bəbir, əjdaha və ağacların şəkilləri birlikdə suvaq üzərinə həkk edilmiş və qalan divarlara da rəsmlər çəkilmişdi. Belə ki, mahir ustalar ona heyran qalardılar. Onun ətraf imarətləri də bu cür idi. Bu evdə Qəmcuda olduğu kimi fırlanan bir çarx vardı, amma bu, ondan daha möhtəşəm və daha böyük idi. Buradan da köç etdilər, hər gün dörd-beş fərsəx getdilər, nəhayət, zilhiccə [ayının] 8-də (14.12.1420) sübh çağında, hələ qaranlıq ikən Xanbalıq darvazasına çatdılar.

Bu, çox böyük bir şəhər idi. Belə ki, hər divarı bir fərsəx olmaqla çevrəsinin uzunluğu dörd fərsəx idi. Şəhər divarlarının ətrafını çəpərləmişdilər. O səbəbdən ki, hələ divarların tikintisi başa çatmamışdı. Bunun üçün hər biri əlli gəz olan yüz min ədəd yonulmuş taxtadan istifadə etmişdilər. Hələ dan yerinin söküldüyü vaxt olduğu üçün darvaza açılmamışdı və elçiləri tikilməkdə olan bürcdən şəhərə daxil etdilər. Onlar padşah sarayının qapısının önündə endilər. O sarayın qapısı önünə yeddi yüz addım miqdarında yonulmuş daş örtük döşəmişdilər. Elə ki bu daş döşəmənin kənarına çatdılar, elçilərə buyurdular ki, "piyada olun!". Onlar piyada şəkildə o döşəmənin üzərindən keçərək sarayın qapısına çatdılar. Qapının iki tərəfində on fil bağlanmışdı: beşi bu tərəfdən, beşi isə o tərəfdən dayanmışdı və onlar xortumlarını yolun üzərinə tutmuşdular. Elçilər fillərin xortumlarının arasından keçdilər və içəriyə getdilər. Hələ hava işıqlı olmasa da, padşahın sarayının qapısı önündə təqribən yüz min adam vardı. Elə ki ilk qapıdan içəri girdilər, orada üz yüz gəzin iki yüz əlli gəzə ölçüsündə bir sahə vardı və o sahənin önündə bir köşk yerləşirdi. Köşkün kürsüsü otuz gəz idi. O kürsünün üzərində əlli gəzlik sütunlar ucaldılmış, onun üstündə bir imarət tikilmiş və altmış gəzin qırx gəzə ölçüsündə bir eyvan düzəldilmişdi. Ondan sonra üç darvaza vardı. Ortadakı daha böyük idi, solda və sağda yerləşənlər isə nisbətən kiçik idi. Ortadakı qapı padşahın giriş qapısı idi və oradan hər kəs keçə bilməzdi. Sol və sağ qapıdan isə xalq keçərdi. Darvazanın arxasındakı köşkün üzərində, solda və sağda kurkə qoymuş və zəng asmışdılar. İki nəfər müntəzir idi ki, padşah nə zaman taxta çıxacaqdır. Bu meydanda qadınlı, kişili təqribən üç yüz min adam cəmləşmişdi və təqribən iki min müğənni dayanmışdı. Onlar birlikdə bəm və zil avaz üzərində köklənərək Xətay dilində və öz üsullarına görə padşaha dua edirdilər. Təqribən iki min nəfər də vardı ki, hər biri əllərində silahlar tutmuşdular. Bəziləri nacax[577], bəziləri zopa, bəziləri zubin[578], bəziləri mizraq, bəziləri polad qarpun, bəzləri təbərzin, bəziləri nizə, bəziləri qılınc, bir dəstəsi gürz, bəziləri Xətay yelpiyi və bəziləri çətir tutmuşdular və çevrə-çevrə evlərin ətrafını və önünü səflərlə bağlamışdılar. Səflərin kənarında müəzzəm sütunlar vardı və evlərin divarlarının hamısı taxtadan və yonulmuş daşdan elə düzəldilmişdi ki, hər sənətin ustadları ona heyran olardılar.

---

[576] Xərvar (farsca "eşşək yükü") – Yaxın Şərq ölkələrində və Orta Asiyada mövcud olmuş çəki vahidi. Təxminən 300 kq-a bərabərdir.

[577] Nəcəq və ya nacax – baltaya bənzər bir silah növüdür *(H.H.Zərinəzadə. Fars dilində Azərbaycan sözləri /Səfəvilər dövrü/. Bakı, 1962, s.390).*

[578] Zubin – ucu iki şaxə olan kiçik nizədir. Köhnə zamanların müharibələrində onu düşmənin üzərinə tullayırdılar *(M.Müin. Fərhəngi-farsi, II c., s.1759).*

Xülasə, hava işıqlanandan sonra köşkün başında dayanıb padşahın nə zaman taxta çıxacağını gözləyən adamlar qəfildən kurkə, dühül, dəmamə (təmbur), sinc, ney və zəng çaldılar. Həmin üç darvazanı açdılar və xalq içəri yüyürdü. Onların qaydası belədir ki, padşahı görməyə yüyürərək gedərlər. Beləliklə, bu meydandan ikinci meydana getdilər. Ora təqribən üç yüz addım idi. Orada digərindən daha əzəmətli və qabağı açıq olan bir köşkün qarşısına taxt gətirdilər. Çevrəsi dörd zər[579] miqdarında olan taxtın ətrafı başdan-başa çadırın ətrafı kimi sarı atlasla örtülmüş, tamamına Xətay zərnişanı, əjdaha, simurq[580] və Xətay naxışları çəkilmişdi. Taxtın üzərinə qızıldan bir kürsü qoymuşdular və soldan, sağdan xətaylılar səf bağlayıb dayanmışdılar. Əvvəlcə tümən, minlik və yüzlük əmirləri dayanmışdılar. Sayları təxminən yüz min olardı və hər biri əlində bir zər uzununda və dörddə bir zər enində taxta tutmuşdu və həmin taxtadan savayı, digər bir yerə baxmağa ixtiyarları yox idi. Onların ardında daha 200 min nəfər vardı ki, cəbbə geymiş, nizə tutmuşdular. Bəzi digərləri isə əllərində sıyırılmış qılınc tutaraq dayanmışdılar və səf qurmuşdular. Bu kafirlər kütləsi o qədər sakit idi ki, elə bil, orada heç bir canlı yox idi.

Sonra padşah hərəmin içindən çıxıb gəldi. Gümüşdən bir nərdivan gətirdilər. Onun beş pilləsi vardı. Onu həmin taxta dayadılar. Sonra taxtın üzərinə qızıldan bir səndəli qoydular. Padşah taxtın başına çıxdı və həmin səndəliyə oturdu. Padşah orta boylu idi, saqqalı nə böyük idi, nə kiçik idi. Amma onun saqqalının iki yüz-üç yüz tükü elə uzun idi ki, səndəli üzərində oturmasına baxmayaraq, üç-dörd halqa vurmuşdu. Taxtın solunda və sağında saçlarını başlarının ortasında düyünləmiş, boynu və çöhrəsi açıq, qulaqlarında böyük və gözəl mirvaridlər olan iki ay üzlü qız əllərində kağız və qələm tutub padşahın nə deyəcəyinə və nə hökm edəcəyinə müntəzir idilər. Padşah hər nə dilə gətirsəydi, onlar qələmə alırdılar. Padşah hərəmə getdikdə isə onlar həmin yazıları ona təqdim edirlər və hökmü dəyişməyin lazım gəlmədiyini dəqiqləşdirdikdən sonra həmin yazıları fərman şəklinə salıb göndərirlər ki, divan əhli onlara əməl etsin.

Xülasə, padşah taxtda qərar tutduqdan və xətaylılar iki tərəfdən səf çəkib dayandıqdan sonra bu elçilər camaatını və bağlanmış dustaqları padşahın qarşısına gətirdilər. İlk öncə dustaqların yarğu (mühakimə) olunması həyata keçirildi. Onların sayı yeddi yüz nəfər idi. Bəziləri zəncirə vurulmuş, bəzilərinin bir əli və boynu taxtaya salınmış, bəzən isə beş-altı nəfərin boynu bir uzun taxtadakı deliklərin içinə salınaraq bağlanmış, başları taxtadan bayıra çıxarılmışdı. Hər kəslə öz günahının dərəcəsinə və qədərinə görə rəftar edilmişdi. Hər biri üçün bir müvəkkil təyin olunmuşdu. Həmin müvəkkil o günahkarın saçından tutmuşdu və padşahın nə hökm edəcəyini gözləyirdi. Sonra [padşah] bəzilərinin zindana salınmasını buyurdu, bir qisminin isə öldürülməsini hökm etdi. Bütün Xətayda heç bir əmir və daruğanın kimisə öldürməyə hökmü və həddi yox idi. Günah iş görmüş adamı tuturdular, günahını bir parça taxtaya yazıb boynundan asırdılar, onu zəncir və boyunduruğa vurdular və onların kafir əqidəsinə görə onun günahının cəzası nə idisə, bunun təyin olunması üçün o günahkarı hətta bir illik yol belə olsa, Xanbalığa, şahın taxtının qarşısına göndərirdilər. Oraya çatana qədər heç kimsə onu başqa yerə apara bilməzdi.

Xülasə, dustaqlar getdikdən sonra elçiləri irəli apardılar. Belə ki, padşahın taxtına çatmağa on beş gəz miqdarında məsafə qalmışdı. Əlində taxta tutmuş əmirlərdən biri yerə diz vurub Xətay xətti ilə elçilərin yazılı əhvalını oxudu. Məzmunu belə idi ki, bunlar uzaq yoldan, xilafətin pənahı olan xaqan həzrətlərinin və onun oğullarının hüzurundan elçi kimi gəlmişlər, padşah üçün hədiyyələr gətirmişlər və onun taxtının ətəyinə baş qoymağa gəlmişlər.

Elə ki şərhi-hal tamam oldu, padşahın tümən əmirlərindən və müqərrəblərindən olan, ərəbcə, farsca, türkcə, moğolca və xətayca bilən, padşahla elçilər arasında kəlməçi (tərcüməçi) olan və padşahın on iki divanından birinə başçılıq edən Mövlana Hacı Yusif Qazı irəli gəldi və öz tabeçiliyində olan bir neçə nəfər dil bilən müsəlman ilə müsəlmanların ətrafında dayandı. Dedilər ki, "əvvəlcə ikiqat olun, sonra da başınızı yerə qoyun!". Elçilər üç kərə başlarını yerə qoydular, amma alınlarını yerə çatdırmadılar. Ondan sonra səltənət sahibi olan əlahəzrət xaqanın və əmirzadə Baysunqurun məktubunu sarı atlas parçaya bürünmüş halda iki əllə yuxarı qaldırdılar. Qayda belə idi ki, cənab padşaha aid olan hər şeyi sarıya bürüyərdilər. Mövlana Qazı gəldi,

---

[579] Nuruosmaniyyə nüsxəsi: "dörd gəz".
[580] Simurq – Qaf dağında yaşadığı bildirilən əfsanəvi bir quşdur.

o məktubu aldı və xacəsarayın[581] əlinə verdi. Xacəsaray isə [məktubu] padşahın yanına apardı. Padşah ondan aldı, açdı və gördü. Sonra yenidən onu xacəsaraya verdi.

Ondan sonra padşah taxtdan endi və səndəlidə oturdu. Üç min ədəd üst geyim dəsti gətirdilər. Onları öz əmirlərinə, yaxınlarına və onların oğullarına geydirdi. Daha sonra elçilərdən yeddi nəfəri irəli apardılar. Əvvəlcə Əmir Şadi Xoca Gögcə, sonra Sultan Əhməd, Xoca Qiyasəddin, Ərğudaq, Ərdüvan və Tacəddin Bəxşini. Onlara dedilər ki, “diz çökün!”. Padşah onlardan əvvəlcə həzrət sultanın əhvalını soruşdu. Ondan sonra soruşdu ki, “Qara Yusif [Şahruxa] elçi göndərib vergi (mal) verirmi?”. Cavabında dedilər ki, “bəli, elçi göndərir və vergi verir; dacilər də onun elçilərinin gəldiyini və mal gətirdiklərini görmüşlər”. Sonra soruşdu ki, “orada taxılın qiyməti bahalıdırmı, yoxsa ucuzdurmu? Nemətlər boldurmu?”. Cavabında dedilər ki, “ucuzdur və nemət boldur”. Dedi ki, “bəli, padşahın ürəyi öz Tanrısı ilə düz olduğu üçün Haqq-taala da ona səadət və nemət bəxş etmişdir”. Sonra dedi ki, “Qara Yusifə elçi göndərmək istəyirəm, çünki orada yaxşı atlar var; yollarda əmin-amanlıqdırmı?”. Dedilər ki, “bəli, əmin-amanlıqdır; amma əgər Şahrux sultanın hökmü olarsa, gedə bilər”. Dedi ki, “onu bilirik”. Ondan sonra dedi ki, “uzaq yoldan gəlmişsiniz, qalxın və aş yeyin!”. Orada elçiləri ilk oturduqları yerə apardılar. Hər biri üçün ayaqlı sini və səndəli qoydular. Hər bir sininin içinə, daha öncə deyildiyi kimi, noğul və s. qoydular.

Aş yedikdən sonra onları, hər biri üçün ayrılmış mənzilə (“yam”) apardılar. Haqqın və dinin yardımçısı olan əmirzadə Uluğ bəyin nökərləri Sultanşah və Bəxşi Məlik oraya yaxın bir yamxanada yerləşdirildilər. Bu yamxanadakı hər mənzildə dəbdəbəli bir çarpayı, atlas və ipək yataq və yastıq, ipək tərlik, xalçalar, eninə və uzununa bükülə bilən və qırılmayan incə həsirlər vardı. Hər kəsə bu cür bir mənzil ayırdılar, qazan, kasa, çömçə, ayaqlı sini verdilər. Hər gün on nəfər üçün bir qoyun, bir qaz, iki toyuq, adambaşı şəri ölçü ilə iki batman[582] un, bir kasa düyü, iki böyük kündə halva, bir parç bal, sarımsaq, soğan, sirkə, duz, Xətayda yetişən əlvan tərəvəzlər, iki kuzə dirasun[583], bir tabaq noğul, hamısı hüsn sahibi olan, səhərdən axşamacan və axşaman səhərəcən iki ayaq üstündə dayanan və bir an belə gözdən itməyən bir neçə cəld və çevik xidmətkar təyin olunmuşdu.

Ertəsi gün zilhiccə ayının 9-u (15.12.1420) idi. Hələ gecə idi ki, “secin”lər gəldi. “Secin” padşah ordugahında elçilərin mülazimləri olan xidmətkarlara deyərlər. Onlar hər yerdə elçilərin ehtiyaclarını (“gərək-yaraq”larını) təmin edirlər. Burada isə onlara “şağavul” deyərlər[584]. Onlar [elçiləri] oyatdılar ki, “qalxın, padşah ziyafət (toy) verir”. Hər biri üçün yəhərli atlar gətirdilər. Elçiləri mindirib padşahın ordugahına apardılar və onları sarayın birinci həyətində oturtdular. Gündüzə qədər o məclisə üç yüz min miqdarında adam toplaşdı.

Elə ki gündüz oldu, orada mövcud olan üç darvazanı açdılar və elçiləri ədalət taxtının ətəklərinə apardılar. Onlar padşah üçün beş dəfə yerə baş qoydular. Padşah taxtdan aşağı endikdə, yenidən elçiləri bayıra çıxardılar və dedilər ki, “özünüzü yüngülləşdirin; çünki əgər ziyafət vaxtı qəfildən ehtiyacınızı qarşılamağa möhtac olsanız, o zaman məclisi tərk edib gedə bilməzsiniz”.

Sonra gəldilər, pərakəndə oldular və yenidən toplaşıb içəri keçdilər. Həyətdən və ilk meydandan keçib ədalət taxtının yerləşdiyi ikinci həyətə çatdılar və oradan da keçib üçüncü həyətə daxil oldular. Buranın olduqca geniş bir səthi vardı. Yeri yonulmuş gözəl və yaraşıqlı daşlardan ibarət idi. Qarşıda döşəməsi altmış gəz miqdarında olan böyük bir platforma vardı. Xətay qaydasına görə oradakı köşklərin üzü cənuba doğru idi. Onların memarlıq üslubu belədir ki, imarətlərin üzünü cənuba doğru tikərlər. Platformanın içində əzəmətli bir taxt qoyulmuşdu. Belə ki, hündürlüyü adam boyundan uzun idi və biri öndən, ikisi isə soldan və sağdan olmaqla üç tərəfdən o taxta gümüş nərdivanlar söykədilmişdi. Orada iki xacəsaray dayanmışdı və müqəvva kağızdan bir şey bağlamışdılar ki, qulaqlarının dibinə qədər gedib çıxırdı. Bundan başqa, nisbətən kiçik bir taxtı da o taxtın üzərinə qoymuşdular ki, padşah onun üzərində otursun. Bu, taxt üzərinə qoyulmuş bir səndəli kimi idi. Amma səndəlidən daha böyükdür, guşəsi və mütəkkəsi çoxdur, ayaqları qəribədir. Onun so-

[581] Xacəsaray – hərəmxanada xidmət göstərən axta nökərlər.

[582] Batman – çəki vahidi. Zamana və məkana görə müxtəlif çəkilərə malik olmuşdur. Bir Təbriz batmanı 2,994 kq-a bərabər idi.

[583] Düyüdən düzəldilən acı bir içki *(Nəvai, şərhlər, s.286).*

[584] Türküstanda (Orta Asiyada) elçilərin və digər qonaqların qarşılanması və yerbəyer edilməsi, habelə onlara xidmət göstərilməsi ilə məşğul olan məmurlar “şağavul” adlanırdılar *(А.Б.Вильданова. Подлинник бухарского трактата о чинах и званиях // Письменные памятники Востока. Москва, 1970, с.43).*

lunda və sağında üzəri qübbəli manqala bənzəyən hündür bir şey qoyulmuşdur. Həmin taxt, manqal və səndəlinin hamısı taxtadan yonularaq düzəldilmişdir və qızılı suya çəkilmişdir. Fəqət bu müddət ərzində onun qızılı suyu heç korlanmamışdır. Bundan savayı, o imarətdəki sütunların, pillələrin və taxtaların hamısını iki-üç rənglə elə boyamış və elə yağ sürtmüşdülər ki, Xorasan və İraq ustaları qətiyyən elə bir yağı və rəngi düzəldə bilməzdilər. Padşahın qarşısına ayaqlı sinilər, yeməklər, noğullar və nəxlbəndlər qoymuşdular. Taxtın solunda və sağında tirkeş və qılınc qurşanmış, qalxan bağlamış halda nüfuz sahibi olan dacilər, onların arxasında əllərində uzun nacaxlar tutmuş əsgərlər, onların da arxasında əllərində sıyrılmış qılınc tutan digər adamlar dayanmışdılar. Onların fikrincə, sol tərəfdə dayananların mövqeyi sağ tərəfdə dayananlardan daha yüksək olduğu üçün elçilərə də sol tərəfdə yer vermişdilər. Ən çox hörmət etdikləri şəxs üçün üç ədəd ayaqlı sini qoyurdular. Ondan daha aşağı dərəcəli adam üçün iki ədəd ayaqlı sini qoyurdular. Digərlərinə isə sadəcə bir ədəd ayaqlı sini ayırmışdılar. Gərək ki, həmin gün min və ya hətta daha artıq sayda ayaqlı sinini adamların önünə qoymuşdular.

Bundan başqa, padşahın taxtının qarşısında, platforma pəncərəsinin önündə böyük bir kurkə qoymuşdular. Səndəlinin üstündə bir şəxs dayanmışdı və onun böyründə saz əhli (musiqiçilər) əllərində müxtəlif sazlar (musiqi alətləri) tutmuş halda müntəzir dayanıb gözləyirdilər. Taxtın önündə yeddi çətir vardı, hər biri bir rəngdə və olduqca dəbdəbəli idi. Bundan əlavə, platformanın xaricində soldan və sağdan təqribən iki yüz min nəfər cəbbə (əsləhə) geymiş adam dayanmışdı. Padşahın taxtının qarşısında bir oxun çətinliklə yetişə biləcəyi bir məsafədə eni və uzunu on gəz olan cunbalıq (alaçıq) kimi bir şey vardı. Onun divarı sarı atlasdan idi və içində padşah üçün xörək və dirasun hazırlayırdılar. Hərgah padşah üçün xörək, dirasun və ya hər hansı bir nemət (qida) gətirsəydilər, saz əhlinin hamısı birdən musiqi çalmağa başlardı və bununla birlikdə o yeddi çətir çarx kimi dövrə vurardı. Belə bir müşayiətlə xörəkləri götürüb yola düşərdilər və [padşahın hüzuruna] yetişərdilər. Xörəyi və dirasunu ayaqları olan böyük qablara tökmüşdülər və qabların üzərinə eyni cinsdən qapaq qoymuşdular.

Bu cür hazırlıqlar tamamlandıqdan sonra elçilər ayaq üstdə durub gözlədilər. Taxtın arxasında hərəmin bir qapısı vardı. Oraya böyük bir pərdə asmışdılar. O pərdənin üzərinə iki tərəfdən ipək ip bağlamışdılar. İpin ucu iki xacəsarayın əlində idi. İpin ortasında bir bəkərə[585] vardı. İpi çəkdikləri zaman pərdə bükülmüş həsir kimi insan boyu qədərincə bükülürdü. Padşah hərəmdən çıxdıqda sazları çaldılar. O oturduqda isə hamı susdu. Padşahın başının üstündə on gəz hündürlükdə bir pərdə bağlamışdılar ki, onun böyüklüyü on dörd gəz ölçüsündə kölgəlik (sayəban) böyüklüyündə idi, sarı atlasdan toxunmuşdu və onun üzərinə "basma" üsulu ilə bir-birinə həmlə edən dörd əjdaha rəsmi vurmuşdular.

Padşah taxtda oturub yerbəyer olduqdan sonra elçiləri taxtın yanına apardılar və buyurdular ki, "başınızı yerə qoyun!". Onlar beş dəfə başlarını yerə qoydular. Sonra padşah işarə etdi ki, otursunlar. Hər biri öz əvvəlki yerində ayaqlı sinilərin önündə oturdular. Ayaqlı sinilərin üzərində olan [qidalardan] savayı, quzu, qaz və dirasun gətirdilər. Oyunçular oyuna başladılar.

Əvvəlcə qızlar kimi üzlərinə qırmızı və ağ boyalar sürtmüş, qulaqlarına mirvarid halqalar taxmış, Xətay işi olan qızılı libaslar geymiş, əllərində rəngli kağızdan və ipəkli qumaşdan düzəldilmiş nəxlbəndlər, güllər və lalələr tutmuş oğlanlar Xətay tərzində rəqs etməyə başladılar. Ondan sonra təxminən on yaşında iki oğlan iki taxta üzərində mayallaq aşıb müxtəlif oyunlar göstərdilər. Daha sonra bir şəxs kürəyi üstə uzanıb ayağını yuxarı qaldırdı. Onun ayağının altına bir neçə böyük qamış qoydular. Başqa birisi qamışları əli ilə tutdu. On iki yaşlı bir oğlan gəldi və onların üzərinə çıxdı. O qamışlar yeddi gəz uzunluğunda idi. O, qamışların üzərində müxtəlif oyunlar göstərdi. Axırda da onları bir qamış qalana qədər bir-bir atdı. Onun üzərində mayallaq aşıb oyunlar göstərdi. Bu qeyri-adi hərəkətlərdən sonra qəflətən özünü qamışın üstündə xəta etmiş kimi apardı. Belə ki, hamı onun üçün "yıxıldı" dedi. Bu zaman kürəyi üstündə uzanıb ayağının üzərində qamışı saxlayan adam yerindən sıçrayıb onu havada tutdu.

Bundan əlavə, çoxlu xanəndə və saz əhli yan-yana dayanmışdı. Bir şəxs yatuğan çaldı və Xəyat üsulunun və ahənginin xilafına olaraq, on iki əsl məqam (muğam) ifa etdi. Başqa birisi onun kimi qaval, digəri də musiqar çaldı. Sonra yenə bunlardan birinin bir əli musiqarda, musiqarçının bir əli qavalda, qavalçının bir

[585] Pərdənin yuxarı qaldırılmasını təmin edən vasitə.

barmağı digərinin ağzında olan neyin dəlikləri üzərində, neyçinin ağzı neydə olsa da, əlində on dördlük zəng (çahardəh parə) çalmaqda idi. Hər biri məqamın xaricinə çıxmadan bu üsulla çaldı. Bu məclis ilk namazın axırına kimi sürdü. Padşah məclisdə oyunçulara və xanəndələrə ənam verdi. Buyurdu ki, çav[586] gətirsinlər və onlara nağd şəkildə pul verdi. Padşah qalxdı və hərəmə getdi. Elçilərə isə izin verdi. O bargahın meydanının ortasında ala qarğa, qara qarğa, çalağan, alabaxta, qumru və göyərçindən ibarət neçə min quş yerə tökülmüş meyvələri dənləyirdilər və adamlardan heç qorxmurdular. Axşam düşdükdə isə onlar sarayın həyətindəki həmin ağaclarda rahatlanırdılar və kimsə onları incitmirdi.

Xülasə, elçilər 823-cü ilin 8 zilhiccə günündən (14.12.1420) 824-cü[587] ilin cəmadiyüləvvəl [ayının] əvvəllərinə (04.05.1421) qədər beş ay ərzində şəhərdə qaldılar. Həmin müddətdə ilk gündən müəyyənləşdirilmiş ülufə tamam-kamal şəkildə günbəgün onlara çatdırıldı. Həmin günlərdə onlara bir neçə dəfə də ziyafət (toy) verdilər və hörmət göstərdilər. Hər ziyafətdə oyunçular əvvəlkindən daha artıq canfəşanlıq göstərdilər.

İlk ziyafətin ertəsi günü Qurban bayramı idi. Xanbalıq şəhərində padşah müsəlmanlar üçün bir məscid tikdirmişdi. Elçilər və şəhərdəki bir dəstə müsəlman o məscidə gedib namaz qıldılar. İki gün sonra elçilərə yenə də ziyafət verdilər. Ziyafət zamanı elçilərə hünərlərini göstərdilər, bir-birindən fərqli oyunlar nümayiş etdirib, görünməmiş hoqqabazlıqlar etdilər.

Padşah zilhiccə [ayının] 17-də (23.12.1420) bir dəstə günahkarı cəza yerinə (“siyasətgah”) göndərdi. Xətay kafirlərinin qaydası belədir ki, hansı günah müqabilində hansı cəzanın veriləcəyi onların dəftərlərində yazılmışdır. Ona görə də bəzilərinin boynunu vururlar, bəzilərini dar ağacından asırlar, bəzilərini də parça-parça edirdilər. Əgər hökm olunsa ki, birisini əzabla öldürsünlər, əvvəlcə saçını təmizləmək (yox etmək) üçün onun başına bir qədər əhəng sürtərlər. Sonra başının ətrafını bıçaqla kəsərlər. Başının dərisini üzüb, sarıq kimi çıxararlar. Ondan sonra dərisi üzülmüş başın üzərinə bir az əhəng töküb onu (müttəhimi) üç yerdən dar ağacına bağlayarlar: əvvəlcə boynundan, sonra belindən və daha sonra ayaq baldırından. Əllərini isə arxadan bağlayarlar. Cəlladlar onlarla üzbəüz dayanarlar. Əgər yüz nəfərin ölümünə hökm verilsə, əlbəttə ki, onları yüz cəllad öldürər. Qayda deyildir ki, bir cəllad iki nəfəri öldürsün. [Müttəhim] bu cür bağlandıqdan bir az sonra cəllad əlində bıçaq və qarmaqla gələrək qarmaqla onların sinəsinin üzərindən bir parça əti tutur və bıçaqla onu kəsir. Sinəsinin üzərində ölçüsü dırnaq qədər olan, pələng dərisinin üzərindəki xallara bənzəyən yaralar açılır. Yeyə şəklində düzəldilmiş qaba bir çubuğu onların sinəsi üzərinə iki əllə möhkəm sürtərək oradan qanı su kimi axıdırlar. Daha sonra qaynar su qazanı hazırlayırlar. Aftava ilə qaynar suyu digər bir şəxs həmin yaraların üzərinə tökür və bir başqası da əlindəki süpürgə ilə onu yuyur. Bu zaman o kafirlər [ağrıdan] nərə çəkərlər, bəziləri isə susub dözərlər. Elə ki bu əməli etdilər və yaraları isti su ilə təzələdilər, onun çiyninə iki bıçaq batırırlar. Açılan dəliyin dağlanması üçün oraya qızdırılmış dəmir şiş soxurlar. Ondan sonra şişi çəkib, gül suyunu şüşəyə tökmək üçün istifadə etdikləri mis qabın borusunu şişin yerinə qoyaraq oraya qaynar su tökürlər. Suyun istiliyindən qırmızı ət ağarır. Bu əməllərdən sonra əgər hələ ölməmişsə, yenidən kəsməyə başlayarlar.

Xülasə, o günün axırınacan həmin şəxsə bu cür işgəncələr verirlər və əgər əzabının daha çox olmasını istəsələr, onu ertəsi günə qədər belə saxlayarlar və bu əzablardan sonra öldükdə, qarnını yarıb bütün orqanlarını çıxarırlar və qabırğalarını ayırırlar. Hər qabırğanı ayırdıqları zaman bıçağı qəssablar kimi ağızlarında tuturlar. Axırda onun bütün qabırğalarını ayırdıqdan sonra balta gətirirlər və o sümükləri doğrayırlar. Sonra araba gətirib, o leşləri ona yükləyərək şəhərin xaricində olan çuxura tökürlər.

Günahkarlar barəsində çox ehtiyat edirlər. Belə ki, padşahın on iki divanı var. Əgər bir şəxs hansısa günahda ittiham olunursa, gərək on iki divanın hamısında onun düşmənləri ilə üzləşdirilməsi nəticəsində günahkar olmağı haqqında qərar qəbul edilsin. Məsələn, əgər on bir divanda bir kəsin günah işlədiyi haqqında qərar verilsə, lakin sonuncu divanda belə bir qərar verilməsə, altı aylıq yol məsafəsində, bundan uzaqda və yaxında olsa belə, o şəxsi təhqiqat aparılması üçün gətirərlər və öldürməyib həbsdə saxlayarlar. Sonra gəlib özünü müdafiə etsin deyə onun [məhkəməyə] gətirərlər ki, bu proses (qəziyyə) sona çatsın. Günahkarların çoxu onların həbsxanasında ölür və padşahın hökmü olmadan, ölmüş adamı torpağa tapşıra bilməzlər.

---

[586] Çav (çao) – kağız pul.
[587] Mətndə 823 yerinə səhvən 822-ci il, 824 yerinə isə səhvən 823-cü il yazılmışdır.

Sözügedən [ilin] məhərrəm ayının 23-də (28.01.1421) padşah ordugahda oturmuşdu. O gün çox soyuq idi. Padşahın ordugahına gedən camaatın çoxu yoxsul xətaylılar idi. Uzaq şəhərlərdən gəlmiş dustaqların hamısı soyuqdan ölmüş və padşah sarayının həyətində və yollarda yıxılıb qalmışdılar. Adamlar və atlar ayaqlarını onların üstünə qoyub keçirdilər. Bir şəxs söylədi ki, "bura şəhərin içidir və sığınaq yeridir; şəhərin xaricində təqribən on min adam dey ayından[588] bu yana soyuqdan ölmüşdür". Necə ki, islam vilayətində itlər ölürlər və küçələrdə, məhəllələrdə ayaq altında qalırlar. O kafirlər onlardan da rəzil bir vəziyyətə düşmüşdülər. Padşahın dustaqları boyunduruqlu və zəncirli halda elə donmuşdular ki, torpağa dönənə qədər o şəkildə qalacaqdılar.

Sözügedən məhərrəm ayının 27-də (01.02.1421) Mövlana Qazı elçilərin yanına adam göndərdi ki, sabah yeni ilin başlanğıcıdır və padşah yeni ordugaha (saraya) köçəcək. Padşahın sözü budur ki, heç kəs ağ rəngdə əmmamə, paltar, taqiyə və çəkmə geyməsin. Onların qaydası belədir ki, ağ libası matəm vaxtı geyərlər. [Ayın] 28-si (02.02.1421) gecəsi hələ gecə yarısı ikən secinlər gəldilər, elçiləri oyadıb ata mindirdilər və yeni ordugaha apardılar. Ora ali bir imarət idi. On doqquz ilə tikilib qurtarmışdı. O gecə həmin böyük şəhərdə hər kəs öz evində və dükanında o qədər fənər və çıraq yandırmışdı ki, elə bil, günəş doğmuşdu. Belə ki, məsələn, əgər yerə bir iynə düşsəydi, onu tapmaq mümkün olardı. O gecə soyuğun zəhri yarılmışdı.

Sonra camaatı yeni ordugaha gətirdilər. Həmin ordugahda bütün Xətaydan, Çindən, Maçindən, Qəlmaqdan, Tibetdən, Qumuldan, Qaraxocadan, Çurçadan[589], dəniz sahillərindən və adları məlum olmayan başqa vilayətlərdən yüz min adam toplaşmışdı və padşah öz vilayətlərinin əmirlərinə ziyafət (toy) verirdi.

Elçilər üçün taxtgahın xaricində ayaqlı sinilər qoydular, öz əmirlərini isə bargahın və taxtgahın içində oturtdular. Həmçinin təqribən iki yüz min adam əllərində qılınc, gürz, nacax, zubin, zopa, hərbə (qısa süngü), təbərzin və döyüş alətləri tutmuş, təxminən bir-iki min adam əllərində əlvan və naxışlı Xətay yelpikləri tutmuş, hər biri çiyninə qalxan qoymuşdu. Oyunçular və rəqqas oğlanlar təkrarolunmaz bir üsulla, əyinlərində şərhi vəsfə və bəyana sığışmayan nəxlbəndlər, taclar və libaslarla oynayıb rəqs edirdilər. O imarətin vəsfi bəyana sığmaz. Müxtəsər, bargahın qapısından ta bayır qapıya qədər min doqquz yüz əlli addım vardı və hərəmin bayır qapısına getməyə kimsə üçün yol yox idi. Soldan və sağdan imarət içində imarət, saray içində saray, bağ içində bağ vardı. Bunların hamısına yonulmuş daş və Çin torpağından bişirilmiş, qəti surətdə cövhəri mərmər daşına bənzəyən yonulmuş kərpic döşənmişdi. Uzunu, eni və çevrəsi iki yüz-üç yüz gəz olan bu daş döşəmələrdə bir tük qədər də olsun əyər-əskiklik yox idi. Elə bil ki, onu cədvəl qələmi ilə (xətkeşlə) çəkmişdilər. Yonulmuş daşlar, üzərilərindəki simurq şəkilləri, işlənmiş və oyulmuş naxışları ilə insanı heyran edən yonulmuş yaşma daşına bənzəyirdi. Daş yonma, ağac işləmələri, suvaqlama, naqqaşlıq, kaşı vurma kimi sənətləri digər ölkələrdə heç kəs belə icra edə bilməz və əgər digər ölkələrin ustadları bunları görsələr, insaflı bir şəkildə etiraf edərlər.

Uzun sözün qısası, günorta vaxtı bu ziyafət sona çatdı və hər kəs öz otağına getdi. Səfər [ayının] 9-da (13.02.1421) səhər vaxtı atları gətirdilər və elçiləri [padşahın] hüzuruna apardılar. Səkkiz gün idi ki, padşah hərəmdən çıxmışdı və şəhərin kənarında düzəltdirdiyi yaşıl bir evə getmişdi. O evdə heç bir surət (rəsm) və büt yox idi. Padşahın adəti belə idi ki, hər il bir neçə gün heyvan yeməzdi, hərəmə getməzdi, heç kəsi yanına buraxmazdı və deyərdi ki, "Asimanın Tanrısına ibadət edirəm".

Xülasə, o gün qayıtmışdı və hərəmə gəlirdi. Çox qələbəlik və əzəmətlə, qoşunun və xidmətçilərin müşayiəti ilə hərəkət edirdi. Qabaqda bəzədilmiş filləri aparırdılar. Qızıldan yumru kəcavəni çiyinlərində tutmuşdular. Üzərində günəşin, ayın, ulduzların, dağın, dənizin şəkilləri çəkilmiş, Xətay xətti ilə yazılmış qara, qırmızı, sarı, yaşıl, zərnigar bayraqları vardı. Onun arxasında və önündə bir sıra [xidmətçilər] nizə, qılınc, nacax, zubin, zopa, hərbə, gürz, şeşpər, təbərzin, zülfü uzun çovqanlar, Xətay yelpikləri və çətir tutmuş halda irəliləyirdilər. Daha beş kəcavəni də bəzəmişdilər; hamısı qızıldan idi və onları da adamlar çiyinlərində tutmuşdular. Şərhə sığışmayan sazların sayı çox idi. Beş min nəfər adam padşahın arxasından və önündən gedirdi. Heç birisi qaydanın xilafına olaraq önə çıxmağa və geri qalmağa cürət etmirdi. Kimsənin cəsarəti yox idi ki, səs çıxarsın. Sanki orada heç bir canlı yox idi. Yalnız padşaha dua edən Xətay sazlarının səsi gəlirdi. Elə ki padşah hərəmə getdi, camaat dağışlışdı və hər kəs öz otağına getdi.

---

[588] Dey – İran günəş təqviminin 10-cu ayı (22 dekabr – 20 yanvar).
[589] İndiki Mancuriya *(Nəvai, şərhlər, s.290).*

Bundan başqa, o günlərdə onların bir adəti var ki, ona çıraq gecəsi deyirlər. Yeddi gecə-gündüz padşah sarayının həyətində taxtadan bir dağ düzəldirlər və taxtanın üstünü sərv budağı[590] ilə örtürlər. Sanki zümrüddən bir dağa bənzəyir. Orada yüz min min (bir milyon?) çıraq yerləşdirirlər. Kağızdan neçə min müqəvva düzəldirlər, çöhrəsinin rəngini və paltarını elə edirlər ki, uzaqdan adama oxşayır. O çıraqlara ip bağlayırlar. Neftdən elə fişənglər düzəldirlər ki, çıraq kimi yanır. Fişəng o iplərə dəyib, yetişdiyi hər çırağı işıqlandırırdı. Belə ki, bir nəfəs anında dağın yuxarısından aşağısına kimi o çıraqların hamısı işıqlanırdı. Şəhərdə də evlərdə və dükanlarda çoxlu çıraqlar yanırdı. Həmin yeddi gündə hər kim günah etsəydi, onu cəzalandırmazdılar. Padşah çoxlu bəxşişlər verirdi. Divanda məhkəmə işinə hələ baxılmamış olanları və zindandakı dustaqları azad edirdilər. Amma həmin il münəccimlər belə hökm vermişdilər ki, padşahın evlərinə zərər vuracaq bir atəş peyda olacaqdır və padşah o səbəbdən çıraq gecəsi təşkil etməmişdi. Amma Xətay əmirləri çıraq gecəsi vədəsində cəm olmuşdular. Sonra padşah onlara ziyafət (toy) verdi və ənam bağışladı.

Yekşənbə günü, səfər [ayının] 13-də (17.02.1421)[591] secinlər gəldilər və elçilərin hamısını padşahın hüzuruna apardılar. Onları sarayın birinci həyətində əyləşdirdilər. Diyardan gəlmiş yüz mindən artıq camaatın hamısı toplaşdı. İlk köşkdə qızıl taxt qoydular və köşkün qapılarını açdılar. Padşah taxtda oturdu və yüz min miqdarında adam taxtın həndəvərində diz çökdülər və başlarını yerə qoydular. Üç nəfər o taxtın üzərinə çıxdılar və padşahın verdiyi hökm və yarlığı aldılar. İki nəfər o yarlığı tutdular və biri yüksək səslə elə oxudu ki, bütün camaat eşitdi. Amma Xətay dilində idi və bizim adamlarımız başa düşmədilər. Məzmunu belə idi ki, onların ilinin başlanğıcı və çıraq gecəsi olan bu ayda bütün dustaqlar, günahkarlar və divanda məhkəməsinə baxılacaq şəxslər bağışlanırlar, yalnız qan tökmüş adamlara bu hökm şamil edilmir və üç il müddətində heç bir diyara getməmiş olan elçilərlə hökmlərin məzmunu digər vilayətlərə göndərilir. Elə ki hökm oxundu, padşahın hökmünə ehtiram üçün bir çətir gətirdilər və onu hökmlərin (hökmlərin yazılmış olduğu sənədin) üzərində tutdular. Qızıla tutduqları bir çubuğun üzərində bir halqa vardı və o halqadan sarı ipək bir ip keçirib həmin hökmü oradan aşağı sallamışdılar. Onun üzərində isə çətir saxlamışdılar. Köşkün ətrafında sazlar, təbillər və nağaralar çaldılar. Hökm aşağı salınan vaxt iki qızıl məhfə hazırlanmışdı. Elə ki hökm aşağı endirildi, onu bir məhfənin içinə qoydular və digər məhfəni öndən apardılar. Bütün sazlar onu müşayiət edirdi. Camaat bayıra çıxdı. O hökmü elçilərin olduqları "yam"a gətirdilər ki, oradan hökmlər hər diyara və vilayətə göndərilsin.

Amma padşah köşkdən endikdə elçiləri çağırdı və günortaya qədər ziyafət verdi. Ziyafət bitdikdə hər kəs bir tərəfə getdi. Sonra rəbiüləvvəl [ayının] başlanğıcında (06.03.1421) elçiləri çağırdılar və padşahın əmrinə əsasən, on qartal hazır etdilər. Sonra padşah buyurdu ki, "qartalı mənim üçün yaxşı at gətirən adama verəcəyəm". Daha sonra həm kinayə ilə, həm də açıq-aydın surətdə (birbaşa mənada) bir çox bu cür sözlər söylədi. Axırda bu on qartaldan üçünü şahzadə Uluğ bəy Kürəkanın elçisi Sultanşaha verdi, digər üçünü şahzadə Baysunqur Bahadır xanın – Allah onun mülkünü və səltənətini əbədi etsin – elçisi Sultan Əhmədə, daha üçünü isə əlahəzrətin (Şahruxun) – Allah-taala onun mülkünü və səltənətini əbədi etsin – elçisi Şadi Xocaya verdi[592]. Amma qartalları öz heyvandarlarına tapşırdı və ertəsi gün elçiləri çağırıb dedi ki, "öz qartallarınızı nişanlayın". Dedilər ki, "nişanlamışıq". Sonra padşah buyurdu ki, "mənim qoşunum vilayətin sərhədinə gedir. Siz də yarağınızı götürüb mənim qoşunumla öz vilayətinizə gedin". Dedilər ki, "padşah necə əmr edirsə, elə edərik".

Ondan sonra Suyurqatmışın – Allah onun qəbrini nurla doldursun – elçisi Ərğudağa dedi:

- Qartal yoxdur ki, sənə verim və əgər olsaydı da sənə verməzdim. Çünki Ərdəşir[593] keçən dəfə onu Soyurqatmışın nökərindən aldığı kimi, bu dəfə də səndən alacaqdır.

O cavabında dedi:

- Əgər padşah lütf buyursa və [mənə] qartal versə, heç kim onu məndən ala bilməz.

Sonra [padşah] onun cavabında dedi:

---

590 Nuruosmaniyyə nüsxəsi: "yaşıl budaqla".

591 Buradakı miladi tarix yekşənbə (bazar) gününə deyil, düşənbə (bazar ertəsi) gününə təsadüf etmişdir.

592 Həsən bəy Rumlu, cağatay heyətinin Çinə səyahətinin təsvirini bütünlüklə Teymuri mənbələrindən götürdüyü üçün bu mənbələrdə Teymuri hökmdarının və şahzadəsinin şərəfinə yer almış duaları da öz əsərinə daxil etmişdir.

593 Daha öncə Çinə getmiş olan Ərdəşir Tuğaçı (və ya Təvaçı) nəzərdə tutulmuşdur *(Nəvai, şərhlər, s.294).*

- Sən burada ol ki, qartal gəlib çıxsın, sənə də verim. Bu yaxınlarda (indilərdə) iki qartal gəlib çatacaq və onları sənə verərəm.

Sonra rəbiüləvvəl [ayının] 8-də (13.03.1421) Sultan Əhmədlə Bəxşi Məliki çağırdı və Xətay dilində “sikeşi” deyilən ənamlar verdi: səkkiz gümüş balış[594], otuz dəst astarlı şahanə paltar, iyirmi dörd topa zərif qumaş parçalar, biri yəhərli və biri yəhərsiz olmaqla iki at, yüz ədəd qamış ox çubuğu, iyirmi beş ox ucluğu, üç Xətay zirehi, beş min çav. Məlik Bəxşiyə də bunun qədər [hədiyyələr verdi], amma [ona] bir balış daha az verildi. Onların xatunlarına gümüş balışsız o qumaşların yarısını şəfqət etdi. Həmin gün Üveys xanın elçisi iki yüz əlli nəfərlə gəlib çatdı. Onun adı Boya Qatma Atka[595] idi. Sonra padşahın hüzuruna gəlib yerə baş qoydular və onların hamısını padşahın camədarlarına[596] verib ülufə təyin etdilər.

Düşənbə günü, [ayın] 13-də (18.03.1421)[597] elçiləri çağırdılar və padşah onları hüzurunda qəbul etdikdən sonra buyurdu ki, “mən ova çıxıram. Siz öz qartallarınızı götürüb saxlayın ki, əgər gec gəlsəm, məəttəl qalmayasınız”. Və bəzi tənələr vurdu ki, “yaxşı qartalları aparırsınız, pis atları gətirirsiniz”. Sonra qartalları elçilərə təslim etdilər və padşah ova getdi. Ondan sonra şahzadə, Nəmtay tərəfindən gəldi və günlərlə padşahın yerində oturdu.

Səkkizinci gün elçilər onu görməyə getdilər. O, padşahın evinin şərq tərəfində padşahın oturduğu kimi oturmuşdu. Solu və sağı da eyni qaydada tərtib olunmuşdu. Əvvəlki kimi elçilərin qarşısına ayaqlı sinilər qoydular, aş yedilər və dağılışdılar.

Rəbiülaxır [ayının] başlanğıcında (05.04.1421) secinlər xəbər gətirdilər ki, padşah ovdan gəlir və onu pişvaz etmək (qarşılamaq) lazımdır. Sonra padşahı qarşılamağa getdilər və ilk namaz vaxtına qədər bayırda qaldılar. Axırda məlum oldu ki, padşah səhəri gün gələcəkdir. Sonra öz otaqlarına qayıtdılar. Elə ki “yam”a çatdılar, Sultan Əhmədin göy qartalı öldü. Həmin gün secinlər gəldilər və dedilər ki, “atlara minin və bu gecə bayırda olun ki, səhər vaxtı padşahı görə biləsiniz”. Həmin vaxt yağış yağırdı. Elə ki atlara mindilər və Mövlana Qazının “yam”ının qapısına gəldilər, onun yanında bir dəstə adamın dayandığını və hamısının da çox kədərli olduğunu gördülər. Bu kədərin səbəbini soruşdular. O, məxfi şəkildə dedi ki, “səltənət şüarlı həzrətin (Şahruxun) padşah üçün göndərdiyi at ov vaxtı ona minmiş padşahı üzərindən yerə salıb və [padşahın] ayağı zədələnib. O isə bu səbəbdən qəzəblənib hökm etmişdir ki, elçiləri bağlayıb Xətayın şərq şəhərlərinə göndərin”. Oradakıların hamısı bu xəbərdən çox kədərləndilər. Həmin kədərli halda ata mindilər və çaşt[598] vaxtının ortasına qədər iyirmi dəfə [padşahın yanına] yol tapmaq istədilər. Amma şəhərə gedən əsgərlərin izdihamı ucbatından ona yol tapa bilmədilər.

Xülasə, gecə yerbəyer olmuş padşahın ordugahına çatdılar. Padşahın ordugahının eni və uzunu hər biri beş yüz addım idi, on gəz hündürlüyündə və dörd addım enində divarı vardı. [Bu divarı] elə ordugahda dayandıqları həmin gecə Xətayda olan qəliblə qısa bir zamanda düzəldib oraya darvaza qoymuşdular. Divarın arxasından isə torpaq götürdükləri üçün orada bir xəndək yaranmışdı. Darvazaların önündə iş bacaran silahlı kişilər qoymuşdular. Xəndəyin ətrafında da sabahacan gözləyən kişilər vardı. Oranın (ordugahın) içində hündürlüyü iyirmi gəz miqdarında olan dörd sütun üzərində dayanan sarı atlasdan kvadrat çətir düzəltmişdilər. Onun ətrafında da hamısı zərnişan sarı atlasdan olan çadırlar və kölgəliklər qurmuşdular. Şəhər mərkəzindən səhraya çıxan kimi ora görünürdü.

Xülasə, o yerə beş yüz addım qalmamışdı ki, Mövlana Qazı yanındakılara atdan enmələrini buyurdu. Yenə padşahın gəlməsi üçün orada dayandılar. Özü isə irəli getdi və padşahın qarşısına çatdı. Xətay dilində birinə “Saray Li Da”, digərinə isə “Xikfu” dedikləri Li Daci və Can Daci ayaq üstdə durmuşdular. Padşah elçilərlə danışmaq istədi. Ondan sonra Li Daci, Can Daci və Mövlana Qazı başlarını yerə qoydular və dedilər:

- Əgər padşah həzrətləri elçilərdən inciyibsə, onların bir günahı yoxdur. Əgər onların sultanları yaxşı at göndərməyibsə, onların bunda nə təqsiri var? Bunlar öz padşahlarına “yaxşı at göndərmək lazımdır” desəydilər də, öz sözlərini ona qəbul etdirə bilməzdilər. Bundan başqa, əgər padşah onların hamısını parça-par-

---

[594] Balış – moğolların istifadə etdikləri pul vahididir. Qızıl balış iki min, gümüş balış isə iki yüz dinara bərabər idi *(Öztürk, şərhlər, s.174).*

[595] “Mətləüs-səədeyn”də Buta Teymur Atka yazılmışdır *(Nəvai, şərhlər, s.294).*

[596] Camədar – hökmdarın və ya digər hörmətli adamların paltarlarını mühafizə edən və onların qarderobuna cavabdeh olan məmur.

[597] Göstərilən miladi tarix düşənbəyə (bazar ertəsinə) deyil, seşənbəyə (çərşənbə axşamına) təsadüf edir.

[598] Çaşt – səhər və günorta yeməkləri arasında olan vaxtdır.

ça etsə belə, onların sultanları üçün heç bir təfavütü olmayacaqdır. O zaman burada və bütün aləmdə padşahın adı pisliyə çıxacaqdır və "bu qədər ildən sonra Xətay padşahı elçilərə zülm etdi, onları həbsə ataraq cəzalandırdı" deyəcəklər.

Bu söz padşahın xoşuna gəldi. Onların dilək və istəklərini təmin edib elçiləri bağışladı. Ondan sonra Mövlana Qazı şad və gülərüzlü halda gəlib müjdə verdi:

- Allah-taala özünün fəziləti və kərəmi ilə bu qərib müsəlman dəstəsinə rəhm etdi və padşahın ürəyinə mərhəmət işığı saldı.

Ondan sonra padşahın istəyi ilə ayaqlı sinilər gətirdilər. O gün donuz ətini qoyun əti ilə qarışdırmışdılar. Müsəlmanlar ondan yemədilər[599]. Sonra padşah dörd ayağı ağ olan qara və hündür bir ata mindi. O atı dinin köməyi ("Müğisəddin") olan böyük əmirzadə Uluğ bəy Kürəkan – Allah onun dövlətini və səltənətini əbədi etsin – göndərmişdi. Onun belinə qızılı qumaş sərmişdilər. Padşah da qızıl işləməli qırmızı əba geymiş, qara atlasdan bir qılaf tikdirərək saqqalını o qılafın içinə qoymuşdu. Üstü örtülü yeddi ədəd kiçik kəcavəni padşahın arxasınca tutub gətirirdilər. O kəcavələrin içində padşahla birgə ova getmiş qızlar vardı. Onların arxasında da yetmiş adamın qaldırdığı böyük və kvadrat şəkilli bir kəcavə vardı. Soldan və sağdan hər ikisi də qızıl işləməli şahanə səltənət libası geymiş iki axtaçı padşahın önündə at ilə uyğun addımlarla hərəkət edirdilər. Sol və sağ tərəflərdə bir ox atışı uzaqlığında iki sıra süvari dəstəsi səf bağlamışdı və heç biri digərindən bir addım belə öndə və ya arxada deyildilər. Göz işlədikcə o hamar çöldə qoşunun səflərini tərtib edirdilər. Bir səfdən digər səfə iyirmi addım məsafə vardı. Belə ki, ordugahdan ata minib şəhər darvazasına çatana qədər səflər şəklində hərəkət etdilər. Padşahın yanında on daci, Mövlana Qazı, Li Daci və Can Daci gedirdi. Daha sonra Mövlana Qazı elçilərin yanına gəlib dedi ki, "padşah sizə yaxınlaşdıqda atdan enin və başınızı yerə qoyun!". Onlar da elə etdilər.

Padşah yaxınlaşdıqda elçilər üzlərini yerə qoydular. Sonra padşah buyurdu ki, "atlara minin!". Elçilər atlarına minib padşahın yanına getdilər. Padşah, Şadi Xocaya şikayət edərək dedi: "Ovda sənin gətirdiyin ata mindim. O at yaşlı və gücsüz olması üzündən yıxılıb məni üstündən atdı. O gündən bəri əlim ağrıyır. Ağrımın bir balaca sakitləşməsi üçün çox qızıl xərclədim". Ondan sonra qartal istədi. Bir durna uçurtdu və qartalı buraxdı. Qartal ona yetişib üç pəncə zərbəsi ilə onu yaxaladı.

Ondan sonra padşah aşağı endi. Bir səndəli gətirib onun ayağının altına qoydular. Başqa bir səndəlini də oturması üçün qoydular. Padşah səndəlinin üzərində oturub Sultanşahı çağırdı və həmin qartalı ona verdi. Başqa bir qartalın da [gətirilməsini] istədi və onu da Sultan Əhmədə verdi. Şadi Xocaya isə [qartal] vermədi. [Padşah] at mindiyi zaman qəfildən bir dovşan göründü. O, qolunun üzərindəki qartalı dovşanın üzərinə atdı. İki it də dovşanın arxasınca qaçdı. Qartal dovşanı tutmaq istədi. İtlər yetişdilər və qartalı hürkütdülər. Dovşan aradan çıxdı və gözdən itdi.

Şəhərin yaxınlığına gəldikləri zaman xətaylılardan və digərlərindən ibarət çoxlu insan şəhər kənarına çıxmışdı. Xətaylılar dəstə-dəstə Xətay dilində padşaha dualar edirdilər. O, belə bir əzəmət və şövkətlə şəhərə daxil oldu. Elçilər öz otaqlarına getdilər.

Rəbiülaxir [ayının] 4-də (08.04.1421), düşənbə günü secin gəlib, elçiləri ata mindirib apardı. Dedi ki, "bu gün padşah sikeşi (ənam) verir". Elçilər yola çıxdılar. Sultanşahla Bəxşi Məlikə geri dönərkən sikeşi verdikləri üçün onları çağırmadılar. Sonra padşah oturdu. Sikeşi sinilərini onun qarşısına topladılar. Sonra onun göstərişi ilə onları bir tərəfə qoydular. Padşah taxtın üzərindən gördüyü əmirləri sinilərin yanına göndərdi.

Ondan sonra ilk öncə Sultan Əhmədi çağırdılar və sikeşi sinisini ona verdilər. Ondan sonra Qiyasəddini, ondan sonra Əmir Şadi Xocanı, ondan sonra Gögcəni, daha sonra Ərğudağı və Tacəddin Bəxşini çağırıb, siniləri onların qarşısına qoydular. Sinilərin üzərində bunlar vardı: Şadi Xocaya on gümüş balış, otuz atlas, qələqi, tərğu (qırmızı ipək bafta), ludşad və kənəki qumaşlarından yetmiş parça, beş min çav; xatunlar üçün çav və gümüş balış verilmədi, ancaq qumaşın üçdə biri verildi. Sultan Əhmədin, Gögcənin və Ərğudağın hər birinə on gümüş balış, on altı atlas və hamısı doxsan dörd parça olan qələqi, tərğu, ludşad və kənəki qumaşları, hər birinin xatunlarına iki min çav verildi. Qiyasəddinin, Ərdüvanın və Tacəddin Bəxşinin hər birinə

---

[599] Bu cümləni Ə.Nəvai "Mətləüs-səadeyn"dən əlavə etmişdir *(Nəvai, s.297).* Halbuki "Əhsənüt-təvarix"in nüsxələrində bu cümlənin əvəzinə belə yazılmışdır: "Müsəlmanlar da ondan yedilər".

yeddi gümüş balış, on altı atlas, hər biri yetmiş yeddi parçadan ibarət tərğu, ludşad və kənəki, iki min çav verildi. Elçilər padşahdan sikeşiləri alıb öz otaqlarına getdilər.

Bu əsnada padşahın sevimli xatunlarından biri vəfat etdi. Həmin matəm üzündən padşahı bir daha görə bilmədilər. O, matəm mərasimi qurtarana qədər görünmədi. Bir neçə gündən sonra, cəmadiyüləvvəl [ayının] 8-də (11.05.1421) dedilər ki, padşahın hərəmi (arvadı) ölmüşdür və həmin günün sabahı onu dəfn edəcəklər. Qəflətən, həmin gecə İlahi qəzadan ildırım şəklində bir atəş asimandan padşahın yeni tikdirdiyi köşkün üstünə düşdü və yanmağa başladı. Elə alışdı ki, sanki yağ və fitillə yüz min məşəl yanırdı. Od düşən bu imarət səksən gəz[600] uzununda, otuz gəz enində, yağlı palçıqdan düzəldilmiş, üç adamın ağuşuna sığmayan laciverd sütunlara malik bargah (saray) idi. Yanğın elə idi ki, bütün şəhər onun işığından işıqlanmışdı və oradan sirayət edib, iyirmi gəz[601] kənarda olan köşkə də yayıldı. O bargahın ardında daha möhtəşəm olan hərəm köşkü vardı ki, o da yandı. O köşklərin həndəvərindəki xəzinə evlərinə də od düşdü. Axırda təxminən iki yüz əlli ev alışdı. O əsnada bir çox kişi və qadın da yandı. Səhər açılanda da yanğın davam etdi. O gün digər namaz vaxtına qədər səy göstərsələr də, o yanğın sönmədi.

Lakin padşah və əmirlər bayıra çıxdıqları üçün yanğına etina etmədilər. Çünki kafirlik dinində o günü mübarək günlərdən sayırdılar. Amma daha sonra padşah bu qüssədən bütxanaya getdi və çox yalvar-yaxar etdi. Dedi ki, "Göyün Tanrısı mənə qəzəbləndiyi üçün taxtımın olduğu yeri yandırdı; mən heç bir pis iş görmədim, atamı və anamı da incitmədim, zülm etmədim". O, bu qüssədən xəstələndi. Bu səbəbdən məlum olmadı ki, həmin ölünü (padşahın arvadını) necə dəfn etdilər və torpağa nə cür tapşırdılar. Amma [onun cənazəsini] çox bəzəmişdilər: çox sayda bayraq, üzəri naxışlı olan rəngli kağızdan düzəldilmiş çovqanlar, eni və uzunu on gəz miqdarında olan müqəvva kağızdan taxt, o taxtın üstündə hamısı rəngli kağızdan düzəldilmiş adam, at və dəvə surətləri, süni meyvələr, yəhər, yüyən və s. Hər birinin üzərində müxtəlif yeməklər, içkilər və araq olan iki min sini. O qadının şəxsi atlarını məzar olan dağın üzərinə buraxdılar. Atlar özbaşına otlamağa başladılar. Heç kim onları yaxalaya bilməzdi. Məzar olan o dağda bir çox qızlar və xacəsaraylar vardı. Onlar orada qazılmış mağaralarda idilər. Onların önünə, tükənənə qədər orada qalıb ölsünlər deyə, beş illik qida (ülufə) qoydular. Bütün bu tərtibata baxmayaraq, o yanğının təlaşı ilə həmin qadını necə apardıqlarını öyrənmək mümkün olmadı. Padşahın xəstəliyi artdı. Oğlu bargaha gəlib oturdu. Elçilərə getmək üçün icazə verildi. Onların icazədən dərhal sonra yola çıxmaları üçün yol ehtiyacları hazırlandı. Buna görə də o hazırlığın bitməsinə qədər onlara ülufə vermədilər[602].

Cəmadiyüləvvəl [ayının] (04.05-02.06.1421) ortasında elçilər Xanbalıqdan ayrıldılar. Dacilər də onları müşayiət edirdilər. Səfər əsnasında gəldikləri hər poçt mənzilində (yam) eşşəkdən arabaya qədər hər ehtiyacları təmin edilirdi. Şəhərlərdə və qəsəbələrdə onlara ziyafət (toy) verilirdi. Rəcəb [ayının] başlanğıcında (02.07.1421) Yengan şəhərinə[603] çatdılar. O şəhərin bütün hakimləri və böyükləri elçilərə və dacilərə hörmət göstərmək üçün şəhərdən çıxdılar. Şəhər çox gözəl idi. Qayda belə idi ki, orada adamların yüklərini açıb içində nə olduğuna baxırdılar. Xətaydan çıxarılması qadağan edilən çav və s. kimi şeyləri aparmaq olmazdı. Amma elçilər fərman almışdılar ki, onların yükləri yoxlanılmasın.

Ertəsi gün elçilərə böyük bir ziyafət verildi. Onlara çox ehtiram göstərdilər. Ondan sonra hər gün köçə-köçə şaban [ayının] 5-də (05.08.1421) Qaramurana çatdılar. Oradan sonra hər gün bir poçt mənzilinə (yam), hər həftədə və ya daha az zamanda bir şəhərə çatırdılar və ziyafətlə qarşılanırdılar. Nəhayət, şaban [ayının] 23-də (23.08.1421), gedərkən heyvanlarını və nökərlərini qoyduqları Qəmçu şəhərinə gəldilər. Adamlarının və orada qoyduqları hər şeyin salamat olduğunu gördülər. Amma [yollardan] quldurluq xəbərləri gəlirdi. Moğolustan yolu təhlükəli idi. O səbəbdən təxminən iki ay yarım orada gözlədilər. Zilqədə [ayının] 17-də (13.11.1421) Qəmçudan hərəkət edib [digər ayın?] 17-də Səkcuya çatdılar. Orada da yoldan gələn xəbərlərin pis olduğunu söylədilər.

---

600 Paris nüsxəsi: "səksən zər".
601 Paris nüsxəsi: "iyirmi zər".
602 Nuruosmaniyyə nüsxəsi: "İcazədən sonra o şəhərdə olduqları müddət ərzində onlara ülufə vermədilər".
603 Yengan (Yenan) – Çinin Sui-Yuen əyalətinin mərkəzində, böyük Şensi şəhərinin yaxınlığında yerləşən bir şəhərdir *(Nəvai, şərhlər, s.301).*

Bir neçə gün orada qaldıqdan sonra oraya Şiraz və İsfahan elçiləri gəldilər. İsfahandan Əmirzadə Rüstəmin elçisi Pəhləvan Cəmaləddin, Şirazdan əmirzadeyi-əzəm (böyük əmirzadə) İbrahim Bahadır sultanın elçisi Əmir Həsən yolun həddən çox təhlükəli olduğunu, oradan qaçıb dağ cığırları ilə gəldiklərini bildirdilər. Bu xəbər üzündən Səkcuda daha bir müddət qaldılar. Axırda 825-ci ilin məhərrəm ayının (26.12.1421-24.01.1422) ortalarında oradan hərəkət etdilər.

Sərhəd məntəqəsinə (qaravul) çatdıqları zaman qala məmurları dedilər ki, "Xətay dövlətin qaydasına görə, ölkəyə daxil olan şəxslərin adları yazılmış dəftərlər çıxarkən yoxlanılmalıdır; əgər belə etməsək, padşah bizə qəzəblənər". Müxtəsər, hamısını qeyd etdilər. Onlar [Çinə getdikləri zaman] 823-cü ilin şaban ayının 19-da (29.08.1420), cümə günü[604] Xətay qaravulunu keçib getmişdilər.

Cümə günü, mübarək ramazanın (məhərrəmin?) 11-də Xətay qaravulundan çıxıb, çöl yolunu tutdular. Rəbiüləvvəlin 18-də (12.03.1422) çöldən keçib, Xötən [quldurlarının] qorxusundan bir neçə gün o səhrada qaldıqdan sonra cəmadiyülaxir [ayının] 9-da (01.05.1422) Xötənə[605] çatdılar. Oradan da köç edib rəcəb [ayının] 6-da (26.06.1422) Kaşğarda dayandılar. Sözügedən ayın 21-də (11.07.1422) Əndican keçidini keçdilər. O yerdən bəziləri Səmərqənd yolu, bəziləri də Fənukin və Bədəxşan yolu ilə getdilər. Şaban [ayının] 21-də (10.08.1422) Hisari-Şadmana, mübarək ramazanın başlanğıcında (19.08.1422) Bəlxə gəldilər. Oradan 825-ci ilin sözügedən ayının 10-da (28.08.1422) darüssəltənə Herata – Allah oranı zərərlərdən qorusun – daxil oldular və səltənətin pənahı olan həzrətin ətəyini öpdülər.

Həmçinin bu il Özbək padşahı Məhəmməd xanın elçiləri Şeyx-oğlan və Polad-oğlan çoxlu peşkəşlə Şahrux padşahın dərgahına gəldilər.

Bu ilin əvvəllərində Şeyx İbrahimin oğlu Əmir Mənuçöhr, Mirzə İsgəndəri Şirvana çağırdı və qardaşlar arasında böyük bir müharibə baş verdi. Mənuçöhr məğlub olub Təbrizə getdi. Buna görə də Mirzə İsgəndər bəla əlamətli ordusu ilə Şirvana gəlib Mahmudabadı[606] qarət etdi. Axırda Xəlilulla, Mənuçöhrü qətlə yetirib bütün Şirvan vilayətini ələ keçirdi.

Həmçinin bu il Şəki valisi Əmir Seyid Əhməd çoxlu peşkəşlə Şahrux padşahın dərgahına gəldi.

### Ölümlər

Sultan Məhəmməd ibn İldırım Bayəzid ibn Sultan Murad ibn Sultan Orxan ibn Sultan Osman Ədirnə şəhərində fani cahandan əbədi aləmə köçdü. Səltənət əyyamı on iki il olub, məmləkəti Rumeli, Anadolu və Təkkə-eli[607] idi.

Onun ölümümdən sonra vəzirləri Əvəz paşa, Bayəzid paşa və İbrahim paşa onun ölümünü camaatdan gizlətdilər və söz buraxdılar ki, Sultan Məhəmməd səfərə çıxmaq əzmindədir. Bursaya yaxşı nitqə malik elçilər göndərib Sultan Muradı çağırdılar və Sultan Murad qırx gündən sonra Ədirnəyə çatıb səltənət taxtına əyləşdi. Sultan Məhəmmədin ölümü məlum oldu və o, öz atasının cəsədini Bursaya göndərdi.

O əsnada Düzmə Müstafa adlı bir şəxs ortaya çıxıb iddia etdi ki, "mən İldırım Bayəzidin oğluyam". Evrenos bəyin oğulları ona qoşuldular. O, Ədirnə vilayətini ələ keçirdi. O vaxt Sultan Murad Bursada idi və Bayəzid paşanı ona qarşı döyüşməyə göndərdi. Onlar Ədirnə yaxınlığında Düzmə Mustafa ilə vuruşdular. Bayəzid paşanın mülazimləri ondan üz döndərib Düzmə Mustafaya qoşuldular. Bayəzid paşa çarəsizlik ucbatından o yaramaza tabe oldu. Axırda da camaatın təhriki ilə öldürüldü. Ondan sonra Düzmə Mustafa Bursaya yollandı ki, Sultan Muradla vuruşsun, uçan xədəng oxu və qan içən qılıncla düşmənin sübhünü axşam və bədxahın gündüzünü zülmət etsin və iti qılınc zərbəsinin küləyi ilə torpağın üzünü atəş kimi qırmızı rəngə boyasın. Yol əsnasında onu burun qanaması tutdu. Bu, üç gün çəkdi. Ondan sonra Ulubad[608] səhrasında da-

---

[604] Göstərilən miladi tarix pəncşənbə (cümə axşamı) gününə təsadüf edir.

[605] Xötən – indiki Çinin tərkibindəki Uyğur Muxtar Vilayətinin cənub-qərbində şəhər. Kaşğardan cənub-şərqə doğru yerləşir.

[606] Mahmudabad – Azərbaycanın Şirvan vilayətində Elxani hökmdarı Mahmud Qazan xan tərəfindən salınmış orta əsr şəhəri. 1978-ci ildə Bakı – Salyan avtomobil yolunun 115 km-də, "Qırxçıraq" adlanan yerdə arxeoloji axtarışlar zamanı aşkar edilən 16 kv.km. sahəyə malik yaşayış yerinin Mahmudabadın qalıqları olduğu ehtimal edilir *(ASE, c. VI, s.395).*

[607] Təkkə-eli – Antalya və çevrəsi.

[608] Ulubad (Ulubat) – Türkiyənin Bursa vilayətinin Karacabey ilçəsində bir kənddir. Orada eyni adlı bir göl də vardır.

yanıb, əzəblərdən və yeniçərilərdən[609] [ibarət] çoxsaylı bir dəstəni sultanın üzərinə göndərdi. Sultan da özünün yeniçəri camaatını onların qarşısına yolladı. Onların əksərini əsir edərək dərgaha gətirdilər. Sultan Murad, Məhəmməd bəy Mixaloğlunu göndərdi ki, onları öz tərəfinə çəksin. O əsnada Evrenos bəyin oğulları və Turxan bəy, Düzmə Mustafadan üz döndərib Sultan Murada qoşuldular. Buna görə də onu tam qorxu bürüdü. Rumeli tərəfə qaçdı. Ədirnə şəhərinə gəldi. Hər tərəfdən çoxlu türklər ona qoşuldular. Bu tərəfdən Sultan Murad hiddətli aslan və qorxunc bəbir kimi Mustafanın və türklərin üzərinə gəldi. İki tərəfin igidləri bir-biriləri ilə yumruqlaşmazdan öncə türklər arxalarını çevirdilər (qaçdılar). Düzmə Mustafa məhdud bir dəstə ilə Yenicə Qızılağacına[610] getdi. Sultan Murad Ədirnəyə daxil oldu. O əsnada Düzmə Mustafanın mülazimləri çarəsizlik üzündən onu tutub Sultan Muradın yanına gətirdilər və [sultanın] fərmanı ilə onu Ədirnə hasarından asdılar.

## 826-CI İLDƏ (15.12.1422 – 04.12.1423) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Sultan Muradın qardaşı Sultan Mustafa müxalifliyini izhar edib, çoxlu qoşun toplayaraq İznik[611] şəhərinə yönəldi və qırx günə yaxın o qalanı mühasirədə saxladı.

Bu möhnətli xəbər Sultan Murada çatdıqda, söz bilən qasidlərini İznik qalasının kutvalı olan Firuz bəyin oğlu Əli bəyin yanına göndərib bunları bildirdi: "Yaxşısı budur ki, qalanı Sultan Mustafaya təslim edəsən və halımızdan qafil olmayasan". Ona görə də Əli bəy[612] qalanı Sultan Mustafaya təslim etdi. Bu tərəfdən Sultan Murad şimşək və külək kimi İznik tərəfə sürətli yürüş etdi və vəd etdiyi gecə şəhərə yetişdi. Əli bəy onu qalaya daxil edib Sultan Mustafanı dustaq etdi. Sultan Mustafanın vəziri Tacəddinoğlu[613] hamamda idi. O, sərsəm halda oradan çıxıb qaçdı. Mixaloğlu[614] onunla rastlaşdı. Tacəddinoğlu onu qətlə yetirib bir viranəlikdə gizləndi. Mixaloğlunun mülazimləri onu tapıb şərlə dolu başını su rənglində olan və ataş kimi yara vuran qılıncla bədənindən ayırdılar və onun ölümünü heç kimə söyləmədən meyitini basdırdılar. Sultan Mustafanı isə Bursada dəfn etdilər.

### Məhəmməd bəy Qaramanoğlunun Antalya şəhərini mühasirə etməsi haqqında

Sultan Murad öz qardaşları ilə münaqişə etdiyi zaman Məhəmməd bəy Qaramanoğlu da müxaliflik etməyə başlayıb çoxlu qoşunla Təkkə-elinə yollandı. Osman Çələbi Təkkəoğlu da çoxlu qoşunla o diyara yönəldi. O, söz bilən qasidlərini Məhəmməd bəy Qaramanoğlunun yanına göndərdi və özünü onun dostlarından saydığını bildirdi. Antalya[615] yaylağına yetişdiyi zaman ona bir xəstəlik üz verdi. Həmin vaxt Antalya valisi olan Firuz bəy də Sultan Məhəmmədin köhnə qulamlarından idi. O da vəfat etdi. Oğlu Həmzə bəy, Sultan Murad tərəfindən Qarahisar subaşısı[616] idi. O, öz mülazimlərindən birini Qarahisarda qoyub, hərəkət bayrağını Antalyaya doğru qaldırdı və həmin şəhəri mühafizə etdi. O, Məhəmməd bəy Qaramanoğlu ilə Osman Çələbinin hərəkətindən agah olduqda tələşa qapılıb, müdriklik və bilik əhli ilə qalmaq və köçmək, gözləmək və getmək barəsində məşvərət etdi. Bəzi müdrik adamlar dedilər:

- Məsləhət budur ki, özün şəhərdə qalasan və bir dəstə igidi sürətli yürüş etmək üçün Osman Çələbinin üzərinə göndərəsən ki, qəflətən ona basqın etsinlər, həmlə küləyi ilə döyüş atəşini alışdırsınlar və düşmənlərin cəmiyyətinin xırmanını yandırsınlar.

Həmzə bəy bu sözü qəbul edib igid ərlərdən [ibarət] bir dəstəni sürətli yürüş etmək üçün Osman Çələbinin üzərinə göndərdi. Onlar tam sürətlə müxaliflərin üzərinə yollandılar. Xəstə (bimar) olan Osman Çələbi naçar halda ata minib döyüş səfi bağladı. Hər iki tərəfdən şeypur və zurna avazı qalxdı. Cəsur kişilərin

[609] Əzəb - əsasən kəndlilərdən təşkil edilən Osmanlı piyada qoşunu. Yeniçəri (hərfi mənası türkcə "yeni qoşun" deməkdir) – islamı qəbul etmiş xristian gənclərdən təşkil olunan və dövlət xəzinəsi hesabına saxlanan Osmanlı piyada qoşunu.
[610] Yenicə Qızılağacı – indiki Bolqarıstan Respublikasının cənub-şərqində yerləşən Yambol (Yanbolu) vilayətinin Elhovo bölgəsidir.
[611] İznik – hazırda Türkiyənin Bursa vilayətində şəhər və ilçə mərkəzidir.
[612] Bu şəxsin adı bəzi mənbələrdə İlyas kimi qeyd edilmişdir *(Nəvai, şərhlər, s.305).*
[613] Qara Tacəddinoğlu Mahmud bəy *(Nəvai, şərhlər, s.305).*
[614] Mixaloğlu Məhəmməd bəy *(Nəvai, şərhlər, s.305).*
[615] Antalya – Türkiyənin Aralıq dənizi sahilində şəhər.
[616] Subaşı – Osmanlılarda şəhərin güvənliyinə cavabdeh olan məmur *(M.İlgürel. Subaşı // TDVİA, cilt: 37, yıl: 2009, s.447-448).*

həmləsinin sərsər küləyindən müharibə atəşi alışdı və igid ərlərin qırğın alovundan döyüşçü dilavərlərin həyat xırmanı yanmağa başladı.

Döyüşdən və vuruşdan sonra Rum ordusu Osman Çələbinin qoşunlarını Hələb kasası[617] kimi sındırdı və onun özünü də qətlə yetirdilər. Onun bacısını çoxlu mallarla birlikdə Antalyaya gətirdilər.

Ertəsi gün Qaramanoğlu igidlik meydanının süvarilərindən [ibarət] bir dəstə ilə Antalya ətrafında dayandı və çərçivə aynanı əhatəyə aldığı kimi qalanı mühasirəyə aldı. Göy cisimlərindən və ulduzların sayından daha artıq bir ordu ilə Antalyanı hər tərəfdən və hər səmtdən dövrəyə aldılar. Həmzə bəyin adamları da darvazaları möhkəmlədib, bürclərə və qala divarlarına çıxaraq top-tüfəng atmağa başladılar. Ox yağışından və tüfəng tüstüsündən günəşin parlaq aynası görünməz oldu. Qaraman ordusunun igidləri və mübarizləri irəli atılıb döyüşə başladılar.

Mühasirə müddəti altı aya çatdıqda Antalya əhalisi Ədirnədə olan Sultan Muradın taxtının ətəyinə bu məzmunda bir ərizə göndərdi: "Təqribən altı aydır ki, biz biçarələr Qaraman qoşununun basqınından və zülmündən mühasirə darısqallığında aclıq kədərinə və möhnətinə düçar olmuşuq. Əgər ali mənşəli hökmdarın ürəyi bu diyara bağlıdırsa, özü şəxsən buraya buyursun və düşmənləri layiqincə cəzalandırsın ki, duaçıların xilasına bais olsun".

Sultan Murad, Qaramanoğlunun şahmatdakı ("şətrənc") vəzir kimi əyri gedişindən (kəcrəftarlığından) xəbərdar olduqda, şahmat fiqurlarından daha izdihamlı və onun xanalarından daha sıx şəkildə olan saysız bir ordu və şövkətli bir qoşunla Antalyaya yönəldi. Bu möhnətli xəbər Məhəmməd bəy Qaramanoğluya çatan kimi dərhal ata mindi ki, şəhər ətrafına çıxıb müşahidə aparsın və zərbə endirmək üçün bir yer təyin etsin. Çox tamaşa etdikdən sonra bir topun qarşısına gəldi. O əsnada rumilər topdan atəş açdılar. Onun mərmisi (daş) havadan yerə düşərək sıçradı və Məhəmməd bəy Qaramanoğlunun sinəsinə dəydi. O, yəhərdən zillət torpağına düşdü. Mindiyi ala at qoşunun arasından çıxıb ordugah tərəfə qaçdı. Qala camaatına aydın oldu ki, bu, Məhəmməd bəyin atıdır. Onların təkbir ("Allahu əkbər") və təhlil ("La ilahə illəllah") avazı göyün əsir (efir) qatına[618] gedib çatdı.

Qaraman əmirləri Məhəmməd bəyin böyük oğlu İbrahim bəyi özlərinə hakim etdilər. Kiçik oğlu Əli bəy isə müxaliflik etməyə başlayıb özünü Antalyaya saldı. İbrahim bəy atasının cəsədini götürüb, yüklərini və mallarını orada qoyaraq Qaraman diyarına tərəf fərar etdi. Sanki qəhredici sərsər küləyindən qarışqa və ilan kimi başını torpaq içində gizlətmişdi və su kimi axıcı olan Misri qılıncın qorxusundan Səməndər[619] kimi atəşgah səmtinə tələsirdi. Tez gedən atəş və sürətli külək kimi qaçış yolunu axtardı və qara torpağın üstü ilə su kimi axaraq tələskən bir halda getdi. Mənzilə yetişdikdə məlum oldu ki, Məhəmməd bəyin üzünü tikan para-para etmişdir. Oradaca dəfn etdilər. Ordu qaladan çıxıb onların mallarını talan etdi. Məhəmməd bəy Qaramanoğlunu öldürmüş mərmini (daşı) böyük hörmətlə zəncirə bağlayıb Antalya darvazasından asdılar. Qaraman camaatından o diyara kim gəlirdisə, həmin daşı onu göstərirdilər.

Antalya hakimi Həmzə bəy, Əli bəy Qaramanoğlunu ərizə ilə Sultan Muradın dərgahına göndərdi. Sultan Murad həddən artıq şad oldu. Şəhəri bəzəyib, sevinc nağarası çaldılar. [Sultan Murad] Həmzə bəy və o diyarın adamları üçün dəyərli xələtlər göndərdi və Təkkə-elinin idarəçiliyini ona verdi. Əli bəy Qaramanoğlu Ədirnə ətrafına çatdıqda, Sultan Murad özünün bütün əmirlərini[620] onu qarşılamağa yolladı. Sözügedən əmirlər mərhum Məhəmməd bəyin yadigarını tam izzət və ikramla cahan padşahının məclisinə gətirdilər. Sultan Murad ona ehtiram və ikram edərək öz yanında yer verdi və ona çeşidli lütflər etdi, hədiyyələr bağışladı. Axırda bu mehmanlıq kürəkənliyə çevrildi. [Sultan Murad] öz bacısını ona nikahlayıb Sofiya əyalətini ona verdi. Bir neçə ildən sonra o, həmin diyarda fani alləmdən əbədi aləmə köçdü.

**Müxtəlif əhvalatlar**

Həmçinin bu il Sultan Murad Əflaq tərəfə gedib o diyarı qarət etdi. Çünki oranın padşahı Trağula (Drakula) Tuna (Dunay) çayını keçib Rumeliyə basqın etmişdi.

---

617 Paris nüsxəsi: "Çini kasa".
618 Əsir qatı (efir qatı) – orta əsr astronomiya elminə görə, hava kürəsinin üzərində yerləşən atəş kürəsi *(Öztürk, şərhlər, s.185).*
619 Səməndər – əfsanəyə görə, daima odda yanan bir quşdur.
620 Nuruosmaniyyə nüsxəsi: "özünün bir dəstə əmirini".

Həmçinin bu il Büraq-oğlan Özbək, Məhəmməd xan Özbəyin ordasını tutub özbək ulusunun çoxuna sahib oldu.

Bu il Mirzə İsgəndər Kürdüstana gedib o diyarı basdıqdan sonra Ərbili mühasirə etdi. Çoxlu savaşdan sonra qala hakimi Əmir Həsəni ələ keçirdi. Mirzə İsgəndər Ərbili öz oğluna verib Təbrizə qayıtdı.

Həmçinin bu il Mirzə Rüstəm Bağdad ətrafına basqın etdi.

Həmçinin bu il Şahvələd oğlu Sultan Məhəmməd Vasiti ələ keçirdi.

### Ölümlər

Məhəmməd bəy Qaramanoğıu vəfasız və pis etiqadlı bir padşah idi. Bir dəfə Sultan Muradla sülh bağlayıb and içmişdi ki, yeddi il düşmənçilik etməyəcəkdir. Lakin az müddət keçdikdən sonra düşmənçiliyə başladı. O diyarın alimləri ərz etdilər ki, "axı siz yeddi illik sülh bağlamışdınız". Cavab verdi ki, "mən "yel" demişdim, "yıl" (il) deməmişdim və indiyə qədər də min yel ötüb keçmişdir". Daim deyərdi ki, "heç bir şey haram deyildir, təkcə daşdan başqa; çünki onu yemək olmur". Yuxarıda qeyd edildiyi kimi, bu il o, top mərmisi ilə öldürüldü.

Bu il Kürdüstan əmiri Məlik İzzəddin Şir vəfat etdi.

## 827-Cİ İLDƏ (05.12.1423 – 22.11.1424) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Rum padşahı Sultan Murad, İzmiroğlunun[621] üzərinə gəlib, onu vilayətindən qovaraq Məntəşa-elini, Sərxan-elini və Həmid-elini[622] ələ keçirdi.

Həmçinin bu il Mirzə Uluğ bəy həbs etdiyi Şir Məhəmməd-oğlanı yenidən öz məmləkətini idarə etməyə göndərdi. O, öz məmləkətinə çatan kimi müxaliflik etməyə başladı. Bu xəbər Mirzə Uluğ bəyə çatdıqda, həddən artıq bir ordu ilə Xocəndə yollanıb o şəhərdə qışlaq etdi. Həmçinin bu il Mirzə Uluğ bəy Cətəyə hərəkət etdi. Büraq-oğlanın elçiləri gəlib, bir neçə qartal və yorğa atlar gətirərək onun Dəşti-Qıpçaq hökumətinin taxtına əyləşməsinin müjdəsini gətirdilər. Mirzə Uluğ bəy elçiyə hörmət göstərib Tursun-oğlanı və Durkəs Barlası çoxsaylı və müqayisəyəgəlməz mallarla təbrik üçün Dəşti-Qıpçağa yolladı.

Bu il Şirvan padşahı Əmir Xəlilulla çoxlu qoşunla Gürcüstan üzərinə hərəkət bayrağını qaldırdı. Ondan ötrü ki, qardaşı Əmir İshaq, Seyid Əhmədin yanına Şəkiyə getmişdi və gürcülərlə ittifaq halında Şirvana qəsd etmək istəyirdi. Gürcülərlə şirvanlılar arasında böyük bir müharibə oldu. Döyüşdən və vuruşdan sonra gürcülər qaçış yolunu tutdular və cəngəlliyə daxil oldular. Şirvanşah onları təqib edib meşəyə daxil oldu. Gürcü qoşunu onları məğlub etdi. Əmir Xəlilulla yüz həsrət və ah ilə Şirvan tərəfə fərar etdi. Gürcülər Şirvan diyarına basqın edib öz vilayətlərinə qayıtdılar.

Həmçinin bu il Zühəl (Saturn), Müştəri (Yupiter), Günəş, Zöhrə (Venera), Ay və Ütarid (Merkuri) əqrəb bürcündə qovuşdular. Ona görə də Hindistanda və Gücəratda min min (bir milyon?) adam öldü.

### Ölümlər

Mirzə Rüstəm ibn Ömərşeyx ibn Əmir Teymur Kürəkan şəvval [ayının] 6-da (01.09.1424) kədərlə dolu dünyadan əbədi aləmə köçdü. Ömrünün müddəti qırx yeddi il olmuşdur. Oğulları: Sultan Əli, Osman, Pir Məhəmməd və Sultan Cəlaləddin. Əmir Hacı onun oğlu Mirzə Osmanı əmirliyə əyləşdirdi.

## 828-Cİ İLDƏ (23.11.1424 – 12.11.1425) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Mirzə Uluğ bəyin Şir Məhəmməd-oğlanla müharibə etməsi

Bu ilin əvvəllərində yaxşı əməl sahibi olan şahzadə Mirzə Uluğ bəy çoxlu ordu ilə Moğolustan üzərinə hərəkət etdi. Yol əsnasında Əmir Loğman Barlası müqayisəyəgəlməz bir ordu ilə Əşpərə hüdudunda qış-

---

[621] İzmiroğlu – Aydın elinin əmiri Cüneyd Aydınoğlu nəzərdə tutulur. O zamanlar Aydın vilayətinin ən mühüm şəhəri İzmir idi *(Nəvai, şərhlər, s.310).*

[622] Burada Həmid-eli əvəzinə Aydın-eli yazılması daha doğru olardı. Çünki Həmid-elini Osmanlı sultanı daha öncə Qaramanlı İbrahim bəydən almışdı. Saruxan-eli, Aydın-eli və Məntəşa-eli Anadolunun qərbində, Egey hövzəsində yerləşən tarixi vilayətlərdirlər *(Nəvai, şərhlər, s.310).* Həmid-eli isə İsparta, Burdur, Egridir bölgələrində yerləşirdi.

laq edən yağı (üsyankar) ulusa basqın etməyə göndərdi. Müxaliflər əmirlərə qarşı döyüşməyə başladılar. Dava-dalaşdan sonra onlar qaçış yolunu tutdular. Əmirlər müzəffər və qalib şəkildə, qeyri-məhdud qənimətlərlə birlikdə Mirzə Uluğ bəyin ordusuna qoşuldular və birlikdə hərəkət bayrağını nifaq əhlinə doğru qaldırdılar. Toququ mövqeyində Şir Məhəmməd-oğlan dəniz kimi təlatümə gələn ordu ilə göründü. Mirzə Uluğ bəy öz qalibiyyətli ordusunu tərtib etməklə məşğul oldu. Sağ cinahda ("meymənə") Arslan Xoca Tərxan və qardaşı Əmir Mahmud qərar tutdu. Sol cinahda ("meysərə") Həri Məlik və Əmir Loğman bahadırlar dəstəsi ilə yerləşdilər. Mirzə Uluğ bəy mərkəzdə ("qəlb") dayandı. O tərəfdən isə sağ cinahda ("bərangar") Payəndə Buğa, sol cinahda ("cəvanğar") Məlik Heydər və mərkəzdə ("qol") Şir Məhəmməd-oğlan qərar tutdular.

Şeir

"Oğlan soyluların və Rüstəm kimi döyüşçülərin yığışmasından,
Yer başdan-başa Qaf dağını[623] qısqandırdı.
Döyüş ahənginə malik iki dəmir dənizində,
Yüz minlərlə nəhəng (timsah) göründü.
Cahan məhşər çölünə döndü,
Hava qoşunun tozanağından qaraldı".

Əcəl qartalı döyüş meydanının fəzasında pərvaz etdi. Bəla şahini qəhr caynağı ilə döyüşçülərin ruhlarını qopardı. Qan yağdıran bulud ildırım xəncəri ilə bahadırların ömrünü şərab şüşəsi kimi göz yaşı ilə doldurdu. Qılıncın can odlayan şimşəyi igidlərin halına gil qədəh kimi güldü. Şir Məhəmməd-oğlan sol və sağ cinahları mərkəzə birləşdirib bir anda həmlə etdi. Lakin Arslan Xoca Tərxan və bahadırlar dəstəsi yerlərindən tərpənmədilər.

Nəzm

"O qızğın aslanlar dəstəsi yerindən tərpənmədi,
Onlar öz ayaqlarını Elburz dağı kimi yerə dayadılar.
Dayandılar dəmir papaqlı igidlər,
İsgəndər səddi kimi o döyüş meydanında".

Mirzə Uluğ bəy düşmən ordusuna həmlə etdi. Şir Məhəmməd-oğlan döyüşməyə tab gətirməyib qaçış yolunu tutdu. Qalib qoşunlar o məğrur güruhu təqib edərək bir çoxlarını qətlə yetirdilər. Mirzə Uluğ bəy, Elçi Buğanı on min süvari ilə o yaramazın ardınca göndərdi və özü Yulduz yaylağına yollandı, oradan da qayıdıb Qərşi[624] mövqeyinə gəldi. O mövqedə bir qaş daşı ("səngi-qaş") vardı. Qədim padşahlar onu Xətay tərəfdən gətirmişdilər. Sahibqiran (Əmir Teymur) həzrətləri istəmişdi ki, o daşı Mavəraünnəhrə nəql etsin və [bunun üçün] Əmir Cahanşahı neçə min adamla orada qoymuşdu. Lakin onlar onu nəql etməkdə aciz qaldılar və Sahibqiran həzrətləri öz təəssüfünü izhar etdi ki, nə üçün daşı gətirmədilər. Mirzə Uluğ bəy orada iki min cəld kişi qoydu ki, o daşı araba ilə darüssəltənə Səmərqəndə çatdırsınlar. O həzrət tam əzəmətlə darüssəltənə Səmərqəndə qayıtdı.

## Ölümlər

Bu il söz ustadlığı meydanına nizam verənlərin seçkini Xoca İsmət Buxari bu fani aləmdən əbədi cahana köçdü. Onun nəsəbi Cəfər ibn Əbu-Talibə[625] çatırdı. Atası Xoca Məsud Buxaranın böyüklərindən idi. Xoca İsmət Buxari şeirdə Əmir Xosrov Dehləvinin yolu ilə gedirdi və o cənabın işlətdiyi mənaların çoxunu öz şeirlərinə daxil etmişdir. Buna görə də birisi onun barəsində demişdir:

Şeir

"Rəhmətlik Əmir Xosrovu gecə gördüm yuxuda,
Dedim: İsmət sənin xırmanından sünbülləri toplayıb,
Onun şeiri sənin şeirindən daha artıq şöhrət tapıb.

---

[623] Qaf dağı – klassik kosmos anlayışlarında yer üzünü çevrələdiyi qəbul edilən əfsanəvi dağ *(K.Yaşaroğlu. Kafdağı // TDVİA, cilt: 24, yıl: 2001, s.144-145).*
[624] Qərşi – indiki Özbəkistanın cənubundakı Qaşqadərya vilayətinin inzibati mərkəzi olan və Buxaradan 150 km. cənub-şərqdə, Qaşqadərya çayı sahilində yerləşən Karşi şəhəri.
[625] Cəfər ibn Əbu-Talib – Həzrət Əlinin qardaşıdır.

Dedi ki, qorxusu yoxdur, onun şeiri elə mənim şeirimdir".

Xoca, Mirzə Uluğ bəyin zamanında sultanlara məddahlıq etməkdən əl çəkmişdi.

## 829-CU İLDƏ (13.11.1425 – 01.11.1426) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Sultan Muradın qulağına çatdırdılar ki, İzmiroğlu Aydın-eli hüdudunda oturub sənin mühafizən altındakı məmləkətləri (məmaliki-məhrusə) qarət edir. Ona görə də Sultan Murad onu dəf etmək üçün çoxlu qoşun göndərdi. İzmiroğlu qantökən ordusu ilə müharibə bayrağını yüksəltdi. Çoxlu döyüşdən sonra o yaramaz məğlub olub Misuzna qalasına[626] sığındı. Rum qoşunları qalanı bir mərkəz kimi dövrəyə aldılar.

Bir gün İzmiroğlu tək-tənha qaladan çıxıb fərar yolunu tutdu. Rumilər onu təqib etsələr də, heç tozuna çata bilmədilər. İzmiroğlu, İbrahim bəy Qaramanoğlunun yanına gedib kömək istədi. Amma bir faydası olmadı. O qayıdıb özünü qalaya saldı. Rum ordusu ətrafdan və yan-yörədən hücum edib onu əsir aldı və oğulları ilə birlikdə öldürdü.

Həmçinin bu il Sultan Murad Las vilayətinə yollandı. O vilayətin hakimi olan Xoca Dursuk[627] fərar etdi. Sultan Murad öz mülazimlərindən birini orada qoyub Ədirnəyə geri döndü.

Həmçinin bu il Şahrux padşahın iltifatının uğuru sayəsində nurların mənbəyi olan Gazərgah məzarının imarəti tikildi[628].

Bu il Şahrux padşah qartallarla ov etmək üçün Sərəxsə[629] yollandı.

### Ölümlər

Əmir Şahməlik, Əmir Teymur zamanında böyük nüfuza malik idi. Belə ki, [Əmir Teymur onun haqqında] buyurmuşdu ki, "fəth olunan hər bir məmləkətdə haranı istəyirsə, onun olsun"[630]. Bu il o, düşənbə günü, rəbiüləvvəl [ayının] 11-də (21.01.1426) Xarəzmdə fani aləmdən əbədi cahana köçdü.

O, son dərəcə xeyirxah bir adam idi. Çoxlu məscid, mədrəsə və ribat[631] tikdirmişdi. Şahrux padşah Xarəzm hakimliyini onun oğlu İbrahim mirzəyə verdi.

Həmçinin bu il Gilan valisi Seyid Rza Kiya o biri dünyaya köçdü. Onun oğlu olmadığı üçün səltənəti oğluna deyil, Məhəmmədə qaldı[632].

Həmçinin bu il Mirzə Rüstəmin oğlu Mirzə Osman şərab içməkdə ifrata vardığı üçün vəfat etdi. Ömrünün müddəti iyirmi iki il idi.

Əmir Hacı onun qardaşı Sultan Cəlaləddini hökumət başına əyləşdirdi. O əsnada xəbər gəldi ki, Məlik İzzəddin Lurun oğlu Şah Hüseyn Borucerdə[633] hərəkət edir. Əmir Pir Hacı və əmirlər qoşun götürüb Borucerdə yönəldilər. Oranın yaxınlığına çatdıqları zaman əmirlər Pir Hacıdan üz döndərib ona qarşı qəsd etdilər. Pir Hacı yükləri ("ağruq") qoyub İsfahan tərəfə tələsdi. Şeyx Əli Vərvəqun onun mallarını ələ keçirdi. Bu əsnada Şah Hüseyn fitnə əhlindən [ibarət] bir dəstə ilə Borucerdə çatıb Şeyx Əlini qətlə yetirdi. Bu xəbərlər Heratda Şahrux padşaha yetişdikdə Əmir Firuzşahı və Yusif Xocanı şanlı-şöhrətli bir ordu ilə o yaramazı dəf etməyə göndərdi. Qum şəhərində Əmir Pir Hacı əmirlərə qoşuldu. Onlar birlikdə Borucerdə yollandılar. Şah Hüseyn müqavimət göstərməyə tab gətirməyib fərar yolunu tutdu. Əmirlər Luristanı tutub İsfahana yollandılar və [oranın] daruğalığı Xavəndşaha[634] verildi.

Bu il Şirvanda taun oldu.

---

[626] Türkiyə tarixində bu adda qalaya rastlamırıq. Ola bilsin ki, burada Anadolu sahilləri yaxınlığında yerləşən Sisam adasındakı İpsili qalası nəzərdə tutulmuşdur *(Nəvai, şərhlər, s.315)*.

[627] Las (Laz) vilayəti – Serbiya nəzərdə tutulur. Lakin həmin dövrdə Serbiya hökmdarı Yorgi Brankoviç idi *(Öztürk, şərhlər, s.190)*.

[628] Gazərgah – Heratın şəhərətrafı rayonudur və məşhur iranlı sufi Xoca Abdulla Ənsarinin məzarı oradadır *(Öztürk, şərhlər, s.190)*.

[629] Sərəxs – müasir İran – Türkmənistan sərhədində şəhər.

[630] Nuruosmaniyyə nüsxəsinin haşiyəsində yazılmışdır: "Bu səbəbdən Qəzvin vilayətinin ən böyük kəndi olan Şal kəndi də onun ixtiyarına verilmişdi" *(Nəvai, şərhlər, s.316)*.

[631] Ribat – yolçuların gecələyib qalması üçün nəzərdə tutulan bina.

[632] Mir Seyid adı ilə tanınan Karkiya Məhəmməd, Karkiya Rzanın qardaşı Mehdi Kiyanın oğludur *(Nəvai, şərhlər, s.316)*.

[633] Borucerd – İranın Luristan vilayətində, Xürrəmabaddan şimal-şərqdə yerləşən şəhər.

[634] Əmir Nasirəddin Xavəndşah – Əmir Cəlaləddin Firuzşahın qardaşı Əmir Ərğunşahın oğludur *(Nəvai, şərhlər, s.317)*.

Həmçinin bu il Şahrux padşah İraq, Fars və Xorasan gəlirlərinin üçdə bir qismini rəiyyətə bağışladı.

### Müxtəlif əhvalatlar

Həmçinin bu il Mirzə İsgəndər Gürcüstan tərəfə qoşun çəkdi. Qardaşı Cahanşah padşah Təbrizə gəldi. Mirzə İsgəndər bu xəbəri eşitdikdə qantökən ordu ilə Təbrizə irəlilədi. Cahanşah padşah müqavimət göstərməyə tab gətirməyib, Reyə gələrək Şahrux padşaha elçilər göndərdi. O həzrət ona ülufə bağışladı.

Bu il bədəvi ərəblər Bəsrəni ələ keçirdilər və İbrahim sultanın mülazimlərini oradan çıxardılar.

Bu il Sultaniyyədə taun baş verdi və çox adamlar vəfat etdi. Şirazda da təqribən otuz min adam vəfat etdi.

## 830-CU İLDƏ (02.11.1426 – 21.10.1427) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Uluğ bəyin Büraq-oğlana məğlub olması

Bu il Uluğ bəy Kürəkanın tərbiyə etdiyi (yüksəltdiyi) Büraq-oğlan Sığnaq[635] vilayəti hüduduna gəlib, Mirzə Uluğ bəyin yanına bir elçi göndərərək ərz etdi ki, "Sizin vasitənizlə öz ulusumu ələ keçirmişəm və Sizin yanınıza gəlmişəm, lütfkarlığınızın intizarındayam". Büraq "Sığnağın gəliri şəri və ürfi olaraq mənə aiddir, çünki cəddim Urus xan Sığnaqda imarət qurmuşdur" dediyinə görə Mirzə Uluğ bəy onun elçisinə hörmət göstərmədi. O əsnada Arslan Xoca Tərxanın mülazimi gəlib Büraq-oğlandan şikayət etdi. Mirzə Uluğ bəy Büraqla müharibə etmək üçün yaraq bağladı və öz hərəkəti barədə Şahrux padşahı məlumatlandırdı. O həzrət onu müharibə və qırğından daşındırmaq istəsə də, eyni zamanda Mirzə Məhəmməd Cukini on min nəfərlə onu himayə etməyə göndərdi. Mirzə Məhəmməd Cuki Ceyhun [çayından] keçdikdə eşitdi ki, Mirzə Uluğ bəy Sığnağa yollanıb. Onun ardınca tələsib ona qoşuldu və onlar birlikdə Büraq-oğlanın üzərinə getdilər. Qarşı tərəf də ayağını sabitqədəm şəkildə möhkəmlədib döyüşə və vuruşa üz qoydu. Hər iki tərəf səflərini qurmağa başladı.

Nəzm

"Onlar iki tərəfli səf qurdular,
Balıqdan aya qədər qoşun çəkdilər.
Dağ görkəmli ordular dəstə-dəstə,
Necə dənizin üzündə su dalğa-dalğa.
Tutdular hər tərəfdə savaş ərləri,
Çaç kamanı[636] və xədəng oxu".

Təsadüf elə gətirmişdi ki, döyüş meydanının ortasında təpələr vardı və bu səbəbdən düşmən ordusu tam görünmürdü. Büraq sol və sağ cinahları öz [ordusunun] mərkəzinə birləşdirib, bir anda həmlə etdi. Cağatay qoşunu məğlub oldu. Mirzə Uluğ bəy istədi ki, o həlak meydanına ayaq qoysun. Əmirlər onun yüyənini tutub döyüş meydanından çıxardılar. O, Pəhləvan Mahmud Rindaninin və Mirzə Məhəmməd Cukinin səyi ilə əcəlin əlindən xilas oldu. Özbəklərin əlinə bol-bol mallar düşdü. Onlar Mavəraünnəhrin ətrafını və yan-yörəsini qarət etdilər.

Bu xəbər Şahrux padşaha çatdıqda, şaban [ayının] başlanğıcında çoxlu ordu ilə Mavəraünnəhr tərəfə hərəkətə gəldi. Səadətli hökmdar Səmərqənd ətrafında dayandığı zaman Büraqla müharibə barəsində sorğu-sual etdi. Bəzi əmirlərə yasaq (cəza) çubuğu vuruldu. Mirzə Uluğ bəyi nəzərdən saldı və axırda yenidən Səmərqənd idarəçiliyini ona həvalə etdi. Padşahın gəlişi haqqında dəqiq məlumat alan Büraq Sığnağı tərk edib qaçdı.

---

[635] Sığnaq – indiki Qazaxıstan Respublikasının Qızılorda vilayətinin şərqində, Tümən-Arık dəmir yolu stansiyasından 18 km. şimal-şərqdə, Sırdəya çayından 20 km. şimalda yerləşən şəhərcik.

[636] Çaç kamanı – tarixi Türküstan vilayətinin Çaç mahalında düzəldilən bir kaman növüdür. Çaç mahalı – indiki Qazaxıstanın cənub və Özbəkistanın şimal-şərq ərazilərini, Çirçik və Anqren çayları hövzəsini, həmçinin Sırdəryanın sağ sahilində yerləşən müasir Daşkənd bölgəsini əhatə edirdi.

## Müxtəlif əhvalatlar

Bu il Şahrux padşah Heratın cümə məscidindən çıxanda, hürufilərin rəhbəri Mövlana Fəzlulla Astarabadinin müridlərindən olan, əyninə keçə geymiş Əhməd Lur adlı bir şəxs əlində kağız tutaraq şikayətçi görkəmində irəli gəldi. O həzrət mülazimlərindən birinə buyurdu ki, onun sözünü (məqsədini) aydınlaşdırıb ərz etsin. Əhməd Lur irəli cumub padşahın qarnına bir bıçaq vurdu. Məngu Quçin oğlu Əli sultan onun qətlinə izin alıb ürəyi istədiyi kimi onun işini bitirdi. Əmir Əleykə Kükəltaş və Əmir Firuz Tərxan məscidin qapısı ağzında süvari halda dayanmışdılar. Padşah Əmir Firuzu çağırdı. O, süvari halda məscidə daxil oldu və bu hadisənin baş verməsindən heyrətə düşdü. Gördü ki, o həzrət kəcavəyə oturmaq istəyir. Ərz etdi ki, "ata minmək lazımdır, yoxsa böyük bir fitnə baş verər; çünki camaat [padşahın] öldüyü-qaldığı barədə tərəddüd edəcək". Buna görə də o həzrət zəif halına baxmayaraq, ata minib Məlik rastabazarından keçməklə Zağan bağına getdi. Cərrahlar onu müalicə etməklə məşğul oldular. Qısa zamanda o həzrət tamamilə sağaldı. Həmin hadisə haqqında belə demişlər:

Şeir

"Tarixin ili səkkiz yüz otuz idi,
Cümə günü, namaz qıldıqdan sonra.
Çox təəccüblü bir hadisə baş verdi,
Xorasanda, özü də ki, Herat şəhərində.
[Şahmat] büsatı üzərindəki vəzir kimi əyri gedən bir kimsə,
Şahruxu vurmaq istəyərkən mat oldu".

Mirzə Baysunqur və əmirlər bu məsələni aydınlaşdırmaqla məşğul oldular. Onun (qəsdçinin) cibindən bir açar tapıldı. Bazardakı bir passajın ("timçə") qapısı onunla açıldı. Bazar əhli dedi ki, "burada belə bir şəxs vardı və taqiyyə[637] tikməklə məşğul idi, onun yanına çoxlu adamlar gəlirdilər, o cümlədən də Mövlana Məruf Xəttat Bağdadi".

Bu Mövlana Mərufun xəttatlıqdan başqa xüsusiyyətləri də vardı, xoş söhbətli və şirin sözlü idi, əsl keçə geyirdi, başına hündür bir keçə papaq qoyurdu və onun ətrafına da zolaqlı keçə sarıyırdı. Herat cavanları onunla həmsöhbət olurdular. Amma olduqca təkəbbürlü idi. Sultan Əhməd Cəlairdən qaçmış, İsfahanda Mirzə İsgəndərin yanına getmişdi və onun kitabxanasında qərar tutmuşdu. Bir gündə min beş yüz beyti son dərəcə lətafətlə yazardı (köçürərdi). Mirzə Baysunqur kağız vermişdi ki, onun üçün Nizaminin "Xəmsə"sini köçürsün. Mövlana kağızı bir ildən artıq saxlasa da, yazılmamış halda geri göndərdi. Buna görə də Mirzə Baysunqur onu müttəhim etdi. Bir neçə dəfə onu dar ayağına gətirdilər. Axırda o, İxtiyarəddin qalasında məhbus edildi. Mövlana Fəzlulla Astarabadinin[638] qızının oğlu Xoca Əzüdəddin və Əhməd Lurla ittifaq etmiş digər adamlar öldürüldülər. Əmir Qasım Ənvarı[639] da Heratdan çıxardılar.

Həmçinin bu il Rum padşahı Sultan Murad Firəng kafirləri ilə döyüşmək üçün çoxlu qoşun göndərdi.

Həmçinin bu il Mirzə Şahrux padşahın oğlu Mirzə Soyurğatmış Kabildə vəfat etdi. Şahrux padşah Kabil hakimliyini onun oğlu Mirzə Sultan Məsuda verdi.

## 831-Cİ İLDƏ (22.10.1427 – 10.10.1428) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Rum padşahı Sultan Murad Göyərçinlik qalasını[640] ələ keçirib Ədirnə şəhərinə qayıtdı.

Bu il Reydə qışlaq edən Cahanşah padşah müxaliflik göstərib, Qəzvin daruğasını qətlə yetirərək o şəhəri ələ keçirdi, o diyarın kiçiklərindən və böyüklərindən çoxlu mallar müsadirə etdi. Bu xəbər alinəsəb padşaha çatdıqda Əmir Fərmanşeyxlə Əmir Seydini çoxlu ordu ilə İraqa göndərdi. Əmir Çakmak Yəzddən, Əmir Sultan İbrahim Qumdan, Məlik Kəyumərs Rüstəmdardan və Əmir Baba Hacı Həmədandan çoxlu qoşunla əmirlərə qatıldılar. Sədrəddin Dərcüzinini öldürdükdən sonra Qəzvinə yönəldilər. Cahanşah padşah bu xəbəri eşitdikdə Tarom tərəfə tələsdi. Əmirlər Sultaniyyəyə getdilər və qalaya çoxlu taxıl gətirdilər.

---

[637] Taqiyə – araqçın tipli baş geyimi.
[638] Hürufilik təliminin banisi Fəzlulla Nəimi nəzərdə tutulur.
[639] Əmir Qasım Ənvar – 1356-1433-cü illərdə yaşamış məşhur Azərbaycan şairi.
[640] Göyərçinlik və ya Güvercinlik (serbcə adı: Qolubats) – hazırda Serbiyanın Braniçevo bölgəsində, Dunay çayının sağ sahilində, Serbiya – Rumıniya sərhədində yerləşən qəsəbə.

Bu il Mirzə İsgəndər izdihamlı bir ordu ilə Şirvana getdi. Əmir Xəlilulla fərar yolunu tutdu. Mirzə İsgəndər Şirvanın mal-qarasını Miyanəyə gətirib [Miyanədə] abadlıq işləri apardı. Daha sonra isə Sultaniyyə qalasını mühasirə etdi. Yusif Xoca qalanı möhkəmlədib müdafiə olunmağa başladı. Sultaniyyənin mühasirəsi uzandığı üçün Yusif Xocanın Babus adlı mülazimi qalanı türkmanlara təslim etdi. Mirzə İsgəndər Təbrizə tərəf qayıtdı.

## 832-Cİ İLDƏ (11.10.1428 – 29.09.1429) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Şahrux padşahın ikinci dəfə Azərbaycana qoşun çəkməsi və İsgəndər Türkmanla müharibə etməsi

Bu ilin əvvəllərində Mirzə İsgəndər Türkman qantökən bir ordu ilə Təbrizdən çıxıb, qoşun və yaraqla İraq tərəfə hərəkət bayrağını qaldıraraq Sultaniyyəni mühasirə etdi. O, Sultaniyyənin, Zəncanın, Əbhərin[641] və Qəzvinin hakimi olan İlyas Xoca oğlu Əmir Yusifi tutub öz diyarına yollandı[642].

Bu xəbər quru və dənizin hökmdarı Şahrux padşaha çatdıqda onun qəzəb atəşi şölələndi.

Beyt

“Əmirlərə həmin saat buyurdu ki,
Elə indicə qoşunları tez hazırlayın”.

Fərmana əsasən, Türküstan, Mavəraünnəhr, Bədəxşan, Kabil, Zabil[643], tamam Xorasan, Kirman, Fars və Xuzistan məmləkətlərində olan əsgərlər hərəkətə gəlib hökmdarın düşərgəsinə yönəldilər.

Beyt

“Yanına elə bir ordu cəmləşdi ki,
Onun çoxluğundan aləm və dağ naləyə gəldi”.

Yaxşı xasiyyətli hökmdar rəcəb [ayının] 5-də (10.04.1429) Heratdan çıxıb, ox zərbəsi ilə qaranlıq gecədə qarışqanın ürəyini ilanın gözünə tikə bilən, oxun ucu ilə zirehdən çeşmə (qan) fışqırdan mahir atıcılarla məqsədə doğru hərəkətə keçdi.

Şeir

“Onların oxu deşər asimanda şirin (şir bürcünün) gözünü,
Oxla havanın üzünü qartalla doluymuş kimi edərlər.
Qılınc buludundan çoxlu qan seli axıdarlar,
Qılıncın əksi ilə günəşin qılıncını gizlədərlər”.

Mirzə Baysunquru, Əmir Əleykə Kükəltaşı və Əmir Şeyx Loğman Barlası mənqəlay [təyin] etdi. Rey ətrafında Mirzə İbrahim Farsdan, Mirzə Rüstəm[644] İsfahandan və başqa sərdarlar da digər yerlərdən gəlib hökmdarın ordusuna qoşuldular.

Zəfərə yaxın olan əsgərlər Qəzvin hüduduna çatdıqda Mirzə İsgəndərin oraya qoyduğu Dəli Əhməd və Əbdül fərar etdilər. Ramazan [ayının] 21-də (24.06.1429) cahan hökmdarı Sultaniyyədə cah-calalla dayandı. Ta şəvval [ayının] başlanğıcına (04.07.1429) kimi orada qaldı. Marağa şəhəri müzəffər əsgərlərin dayanacaq yeri olduqda belə bir xəbər gəldi ki, Mirzə İsgəndər cövşən geyən bahadırların qorxusundan Əlincəqdən Səlmasa[645] köçərək, sağdan dağla və soldan su ilə əhatə edilmiş bir yerdə qərar tutub, ordugahının dörd tərəfində xəndək qazdırıb. Həmin xəbər üzündən o həzrət (Şahrux) Mirzə İsgəndərin üstünə yollandı. Şənbə günü, zilhiccətül-həram ayının 10-da (10.09.1429) Səlmasda türkman qoşunlarının müqabilində cahcalalla dayandı.

Ertəsi gün hər iki tərəf ordunun səflərini düzəltdi. Şahruxun sağ cinahında Baysunqur qərar tutdu. Mirzə Məhəmməd Cuki sol cinahda yerləşdi. O tərəfdən də Mirzə İsgəndər əlli min süvari və piyada ilə mükəmməl və müsəlləh vəziyyətdə qarşıda mövqe tutdu. Fələk rəftarlı, dağ görkəmli, bulud görünüşlü, ifriti xa-

---

[641] Əbhər – Cənubi Azərbaycanda, Zəncanla Qəzvin arasında yerləşən şəhər.

[642] Mirzə İsgəndərin Sultaniyyə səfərinin təsviri təkrardır və h. 831-ci il hadisələrinin də sonunda qeyd edilmişdir. “Mətləüs-sədeyn”də bu hadisə h. 832-ci il hadisələri çərçivəsində verilmişdir *(Nəvai, şərhlər, s.325).*

[643] Zabilistan (Zabulistan) – tarixi Sistan vilayətinin bir hissəsi olub, Zabul (Zabil) şəhərini və onun ətrafını əhatə edir, müasir İran – Əfqanıstan sərhədində, Hilmənd çayının mənbəyində yerləşir.

[644] Burada bir yanlışlıq var. Çünki həmin zaman Mirzə Rüstəm artıq ölmüşdü *(Nəvai, şərhlər, s.326).*

[645] Səlmas – Cənubi Azərbaycanda, Urmiya gölündən şimal-qərbdə şəhər.

tırladan, şimşək kimi yara vuran, ildırım kimi şığıyan, bulud kimi sürətli, göy gurultusu kimi hay-küylü, dəniz kimi coşqun, atəş kimi qızğın fillər döyüş meydanına bulud və külək kimi tələskənliklə cumdular və yüyürdülər[646].

Nəzm

“Ordu iki tərəfdən səf çəkdi,
Onların xəncərindən günəşin qızdırması qalxdı.
Ordunun önünə fil gətirdilər,
Cahan Nil dəryasını xatırlatdı.
Süvari döyüşçülər arxadan və fillər öndən,
Hamı öz canından ümidini üzdü.
Elə bil ki, hava durmadan gurlayırdı,
Onun gurultusundan torpaq coşurdu”.

Mirzə İbrahim sultan Fars və Kirman ordusu ilə müxaliflərə həmlə etdi. Mirzə İsgəndərin qardaşı Mirzə Cahanşah cövşən geyən bahadırlar dəstəsi ilə müdafiə olunmaq üçün irəli gəldi. Cahan hökmdarının bahadırlarının qəhredici sərsər küləyindən düşmənlərin üzünə rəzillik tozu qondu. Onlar döyüşdən üz döndərdilər.

Nəzm

“İsgəndər Türkman agah oldu ki,
Meşə coşqun bəbirdən xalidir.
Yerindən tərpəndi əzəmət və şövkətlə,
Elə bir şövkətlə ki, ondan dağ lərzəyə gəldi”.

O, savaş meşəsinin aslanlarından və adlı-sanlı bahadırlardan [ibarət] bir dəstə ilə Mirzə İbrahimin ordusuna basqın etdi. Dörd qanadlı xədəng oxu və cövşən deşən nizə ilə meydanın səthini igidlərin xofundan iydə rənginə (qırmızı qana) boyadılar.

Beyt

“İgidlərin qanından çöldə sel əmələ gəldi,
Bu qan selində döyüşçülərin başı üzürdü”.

İgidlərin [atlarının] yüyəni sola və sağa dönürdü. Süvarilərin zərbəsindən cövşən altındakı dəri geyimlər yarılırdı. Aslan ürəkli türkmanların həmləsindən və təzyiqindən fil filin üstünə yıxılırdı. Döyüş alovundan savaş ərlərinin üzərindəki silah közərirdi.

Nəhayət, günəşin simurğu məğribin Qaf dağının arxasına çəkildi, gündüzün ağ qartalı zülmət yuvasında gizləndi, gecənin qara qartalı asimanın zərli yumurtasını öz qanadları altına aldı və hava günəşin fərağından quzğun qanadı rəngində matəm paltarı geydi.

Şeir

“Həmin gecə ki, bu qəribə bağın xurma ağacından,
Tuti uçdu və [yerində] qarğa əyləşdi”.

Ondan sonra hər iki tərəf [döyüşdən əl çəkib] bir-birinin qarşısında yerləşdilər.

Şeir

“Sübh çağı ki, bu amansız qatil (günəş),
Məşriqdə buludlarından arxasından bir teşt kimi çıxdı.
Üzü kin atəşindən qızarmışdı,
O, bir cahanı yandıra biləcək gücdə idi”.

Hər iki qoşunun igidləri və hər iki ölkənin bahadırları bir-birinin qarşısında İsgəndər səddi və Xeybər qalası kimi dayandılar. O əsnada Mirzə Baysunqur, Mirzə İbrahim sultan və Mirzə Məhəmməd Cuki əmirlər, dövlət ərkanı və Bəhram kimi qızğın bahadırlarla birlikdə, Mirzə İsgəndərin sığındığı və qərarlaşdığı xəndəkdən və arxdan keçib, iti qılınc zərbəsi ilə İsgəndər Türkmanı məğlub edib qovdular və o bəla əlamətli or-

---

646 Fillər Şahruxun ordusuna məxsus idi *(Nəvai, şərhlər, s.326).*

dudan təqribən beş min nəfəri qətlə yetirdilər. Yusif Xocanı məhbus kimi saxlayan Əmir Baydu onu azad edib ali taxtın ətəyinə gətirdi.

Nəzm

“Türkmanlar kütləsinin şahı uzaqdan,
Öz qələbə bayrağının aşağı endiyini gördüyü zaman,
Onun ümidinin bayraqları da başı aşağı düşdü,
O, doğru düşüncə qabiliyyətini itirdi”.

Sonra cağatay bahadırlarının əlinə çoxlu canlı və cansız qənimətlər düşdü. Mirzə Məhəmməd Cuki Muş səhrasına qədər onları təqib edib hökmdarın ordusuna qayıtdı.

**Müxtəlif əhvalatlar**

Bu il Sultan Mahmud, Büraq-oğlanı qətlə yetirib özbək ulusuna sahib oldu.

**833-CÜ İLDƏ (30.09.1429 – 18.09.1430) BAŞ VERMİŞ HADİSƏLƏR**

Məhərrəmül-həram [ayının] 8-də (07.10.1429) Şahrux padşah müqayisəyəgəlməz bir qoşunla Səlmas ətrafından Əlincəq qalasına yönəldi. Mirzə İsgəndər Türkmanın tabeçiləri çoxlu peşkəş göndərdilər. Buna görə də o həzrət onların günahlarından keçib səfər [ayının] 19-da (17.11.1429) Qarabağda dayandı. Qara Yusif Türkmanın oğlu Əmir Əbu-Səid fələk şövkətli orduya gəldi. O həzrət Azərbaycan hakimiyyətini ona həvalə edib şaban [ayının] 11-də (05.05.1430) hərəkət yüyənini Xorasan tərəfə döndərdi. Ramazanın 17-də (09.06.1430) Sultaniyyəyə çatdı və ayın axırına qədər o məkanda dayandı. O zaman xəbər gəldi ki, Mirzə İsgəndər Adilcevaz ətrafındadır. O həzrət Cuki mirzəni adlı-sanlı əmirlərdən və izdihamlı qoşunlardan bir dəstə ilə Mirzə İsgəndərə qarşı vuruşmağa göndərdi. Onlar qəflətən Mirzə İsgəndərin ordusunun üzərinə gəldilər. Mirzə İsgəndər ayaqyalın halda üzəngisiz ata minib fərar yolunu tutdu. İzdihamlı əsgərlər onun yüklərini (“ağruq”) talan edib, aləmin pənahı olan dərgaha gəldilər. Şəvval ayında (23.06-21.07.1430) Mirzə İbrahim sultan, Mirzə Rüstəm[647] və b. hakimlər öz diyarlarına yollandılar. Əbhərə çatdıqda Taroma bir dəstə göndərdilər. Əmir Hüseyn qalanı möhkəmləndirdi. Əmirlər qalanı bir mərkəz kimi araya aldılar və mancanaq zərbəsi ilə qala bürclərini viran etdilər. Əmir Hüseyn aləmin pənahı olan dərgaha çoxlu miqdarda hədiyyə və peşkəş gətirib o həzrət tərəfindən qəbul edildi.

Həmçinin bu il Dərbəndin irsi hakimi olan İsfəndiyar, Şahrux padşahın qorxusundan Dərbəndi tərk etdi. Əmir Xəlil o həzrətin (Şahruxun) fərmanı ilə oraya yiyələndi. Məhərrəm [ayının] 20-də (08.10.1430) o həzrət Zağan bağına çatdı.

**Müxtəlif əhvalatlar**

Həmçinin bu il Qara Yusif Türkmanın oğlu İsfahan mirzə bir dəstə igidlə Hilləyə yollandı. Sultan Üveys İlkaninin övladlarından (nəslindən) olan Sultan Hüseyn şəhərə sığındı. [Yemək üçün] itdən və pişikdən bir nişan qalmadıqdan sonra o, əhd-peymanla Mirzə İsfahanın yanına gəldi və onun fərmanı ilə öldürüldü.

Həmçinin bu il Məhəmməd xan Dəşti-Qıpçaq tərəfdən Xarəzm üzərinə bir qoşun göndərdi və onlar o çevrədə çoxlu dağıntılar törətdilər.

Həmçinin bu il Məhəmməd xan Krıma basqın etdi.

Mirzə Baysunqur zilqədə [ayının] son günündə (20.08.1430) Sayınqaladan süvari halda sürətlə yola çıxıb, uzaq və uzun yolu doqquz gündə qət edərək zilhiccə [ayının] 8-də (28.08.1430) darüssəltənə Herata çatdı.

[647] Mirzə Rüstəmin adının burada qeyd edilməsi yanlışdır *(Nəvai, şərhlər, s.329)*.

**Ölümlər**

Bu il Mövlana Cəlaləddin Yusif Evbehi Heratda fani dünyanın torpağından axirət mənzilinə köçdü. O, Mövlana Səədəddin Məsud Təftəzaninin yanında elm təhsili almışdı. Əqli və nəqli elmlərdə məharəti o dərəcəyə çatmışdı ki, Mövlana Məsud ona "əgər mənim əsərlərimdə bir səhv tapsan, islah edərsən" demişdi.

Əmir Firuzşahın iştirak etdiyi ali məclisdə Şeyx Məhəmməd Cəzəri "Kəşşaf"[648] kitabından "Allah şahidlik etdi ki, özündən başqa heç bir tanrı yoxdur"[649] ayəsinin təfsiri barədə dərs verdi və buyurdu:

- Mövlana Səədəddinin bu bəhsdə yazdığı haşiyəyə qarşı on dənə etirazım var.

Mövlana Yusif buyurdu:

- Bəyan et!

O, bir qismini dedi və Mövlana Yusif ona qarşı çıxıb altı dənə etirazını elə qaydada rədd etdi ki, məsələ bütün iştirakçılara aydın oldu. Sonra isə dedi:

- Digər dörd sözü (etirazı) də bununla müqayisə edin və bilin ki, əgər Mövlana Səədəddin bir haşiyəsinə on etirazın deyilə biləcəyi bir adam olsaydı, onun əsərləri şərqə və qərbə yayılmazdı.

Həmçinin bu il görkəmli və fəhmli Mövlana Qiyasəddin Cəmşid Kaşi ramazan [ayında] (24.05-22.06.1430) Səmərqənd şəhərində dünyadan köçdü.

Həmçinin bu il yüksək şöhrətli hədis şərhçilərinin öndəri və uca məkanlı alimlərin rəhbəri Şeyx Şəmsəddin Məhəmməd Cəzəri rəbiüləvvəl [ayının] 5-də (02.12.1429) vəfat etdi. Bunlar onun əsərlərindəndir: tarix elmi haqqında "Cihadiyyə" ("Cihad kitabı") və "Təshihi-Məsabih" ("Çıraqlar təshihi").

Həzrət Mövləvi illərlə Rum padşahı İldırım Bayəzidin xidmətində olmuşdur. Əmir Teymur o diyarı işğal etdikdə cənab Mövləvi onun hüzuruna çıxmaq şərəfinə nail olmuş, o həzrət də onu Səmərqəndə göndərmişdi.

Bu il Mövlana Məhəmməd əl-Xəvafi o biri dünyaya köçdü. Ondan soruşdular:

- Nə üçün evlənməyə meyil göstərmədiniz?

Cavabında buyurdu:

- Vəladət (doğum) zənciri Adəmdən bu zəifə qədər gəlib çatmışdır. İstəyirəm ki, zəncirin bir ucu Əbülbəşərin (bəşəriyyətin atası Adəmin) əlində olsun, digər ucu da bu bəndənin əlində olsun.

**834-CÜ İLDƏ (19.09.1430 – 08.09.1431) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA**

Bu il Əbülxeyr xan Özbək müzəffər ordu ilə Dəştdən (Dəşti-Qıpçaqdan) Xarəzm ətrafına gəldi. Mirzə Şahməlikin oğlu Mirzə İbrahim, Şahrux padşahın tərəfindən o diyarın hakimi olsa da, müqavimət göstərməyə taqət gətirməyib Xivəq[650] tərəfə qaçdı. Xoca Əsiləddin qalanı mühafizə etdi. Özbəklər qalanı ələ keçirdilər. Soyğun və qarətdən sonra onlar Dəşt tərəfə qayıtdılar. Şahrux padşaha xəbər çatdıqda əmirləri özbək ulusuna basqın etməyə göndərdi və onlar o elə basqın edib istila bayrağını yüksəltdilər.

Həmçinin bu il Rum padşahı Sultan Murad Sənəlik (Selanik)[651] vilayətini ələ keçirib çoxlu qənimətlərlə Ədirnə şəhərinə qayıtdı.

Bu il Hacı Sorx, Fəzlulla Astarabadinin bir sıra müridləri ilə İsfahanda baş qaldırdı. Onlar Əmir Əbdüssəmədin iki oğlunu öldürdülər. Qala əhli onlarla müharibə edib onları tutdular və Hacı Sorxun dərisini soydular.

Bu il Mirzə İsgəndər Gürcüstan tərəfə gedib çoxlu dağıntı törətdi. Şirvan valisi Əmir Xəlilin qoşunundan qalada olan Köhnəpuş, Mirzə İsgəndərin ordugahını qarət etdi.

Bu il Təbrizdə qəhətlik baş verdi. Təqribən yüz min adam tələf oldu.

---

[648] "əl-Kəşşaf" – Mötəzilə alimlərindən Zəməxşərinin (ö. 538 / 1144) "Quran"a yazdığı təfsir *(A.Özek. el-Keşşaf // TDVİA, cilt: 25, yıl: 2002, s.330-331).*

[649] *Qurani-Kərim, "Ali-İmran" surəsi, 18-ci ayə.*

[650] Xivəq – Özbəkistanın Xarəzm vilayətindəki Xivə şəhəri.

[651] Selanik – Yunanıstanın şimal-şərqində mühüm liman şəhəri.

**Ölümlər**

Bu il övliyalıq dərəcəsinə malik və hidayət məqamına layiq olan həzrət, irşadın[652] pənahı, müsbət cəhətləri özündə cəmləyən, tovhid[653] gülşəninin nəğmə söyləyəni, yalnızlıq məclisinin xəlvətində oturan,

Beyt

“Xanəgaha, tərkidünyalığa və təcridə[654] layiq,
Ədl və tovhid bargahının əmiri,
Surətdə təriqət bostanının sərvi,
Mənada həqiqət eyvanının şamı”,

əzəli sirrlərin kəşfedicisi Əmir Nurəddin Nemətulla Vəli[655] fani dünyadan əbədi cahana köçdü. Onun əfi ilan dərisindən bir xirqəsi[656] vardı və yeddi dəfə Həccə piyada getmişdi.

## 835-Cİ İLDƏ (09.09.1431 – 27.08.1432) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA

Bu il Rum padşahı Sultan Murad Engirüsü[657] qarət edib çoxlu mallar və saysız qənimətlərlə Ədirnə tərəfə qayıtdı.

Həmçinin bu il Qara Yusif Türkmanın oğlu Mirzə İsgəndərin oğlu Yarəli atasından üz döndərib Şirvana gəldi. O diyarın valisi Əmir Xəlil onu tutub Şahrux padşahın dərgahına göndərdi. O həzrət mərhəmətinin kamilliyi üzündən onu himayə etdi. O, bir müddət ali məqamlı padşahın xidmətində oldu. Bir gün o həzrət, Ustad Fərəc Rixtəgərin düzəltdiyi və dörd yüz batmanlıq daşları ata bilən mancanağa tamaşa etmək üçün ata minib, daş atmaq yeri olan Palikah dağının şimalında dayanmışdı. Qəflətən Yarəli peyda oldu. O, kamil hüsn və lətafət sahibi olan bir cavan idi, xeyli yaraşıqlı və məlahətli idi. Şəhər camaatı birdən ixtiyarsız olaraq ona tərəf yüyürdü və elə bir tərzdə onun arxasınca getdilər ki, mancanağın ətrafında kimsə qalmadı. Şahrux padşah bunu müşahidə etdikdə çaşıb qaldı və Yarəlini həbsə alıb Səmərqənd tərəfə göndərdi.

Həmçinin bu il Əmir Baba Hacı Həmədani, Qara Yusif Türkmanın oğlu Əmir Şah Məhəmmədi qətlə yetirdi.

Həmçinin bu il Qara Yusif Türkmanın oğlu Mirzə İsgəndər öz qardaşı olan və Şahrux padşah tərəfindən Azərbaycana [hakim] təyin edilən Əmir Əbu-Səidi qətlə yetirib o diyarı ələ keçirdi.

Həmçinin bu il Şahrux padşah, Mirzə Baysunquru Əmir Əleykə Kükəltaş və Əmir Firuzşah Tərxanın qardaşı Əmir Məhəmməd Sufi Tərxan kimi böyük əmirlərlə birlikdə Astarabad tərəfə göndərdi.

## 836-CI İLDƏ (28.08.1432 – 17.05.1433) BAŞ VERMİŞ HADİSƏLƏR

Bu il Rum padşahı Sultan Murad Sinan bəyi, İshaq bəyi, Turxan bəyi və Əli bəy Evrenosoğlunu Arnavut (Albaniya) vilayətinə basqın etməyə göndərdi. Onlar o diyarı tutub Ədirnəyə qayıtdılar.

Həmçinin bu il Mirzə İsgəndər Türkman Şirvana böyük bir qoşun çəkdi. Əmir Xəlilulla qaçış vadisinə üz qoydu. Şirvanın əksəri türkmanların soyğun və qarəti ilə paymal oldu. Zülm və əzab əli oraya toxundu. Bir ildən artıq o diyarda əmin-amanlıq olmadı.

Həmçinin bu il Kürd Ramazan, Səba[658] qalasında yağı oldu (üsyan etdi).

Həmçinin bu il Baba Hacı İraqi, Təbriz şəhərini talan etdi.

Qara Yusif Türkmanın oğlu Əmir Əbu-Səid Azərbaycanı ələ keçirdikdən sonra hərəkət bayrağını Ərdəbil tərəfə qaldırdı və o diyara basqın edib Cahanşah padşahı tutdu. Axırda Əmir Bayəzid Bistamın sözü ilə Cahanşah padşahı azad edib Mirzə İsgəndərlə savaşa yollandı və səbir etmədi ki, Əmir Bayəzid öz qoşunu ilə ona birləşsin. Mirzə İsgəndərlə müharibə etdi və ələ keçirilib onun fərmanı ilə öldürüldü[659].

---

652 Hidayət və irşad – insanlara doğru yolu göstərmək, onları haqq yoluna yönəltmək mənasındadır.
653 Tovhid – vahid Allaha inanmaq.
654 İlahiyyat elmində “təcrid” anlayışı dünyadan əl çəkib Allaha yönəlmək mənasında işlədilir.
655 Şah Nemətulla Vəli – Nemətullahi sufi təriqətinin banisidir.
656 Xirqə – dərvişlərin geydikləri üst paltar.
657 Engirüs – Macarıstan.
658 Nuruosmaniyyə nüsxəsi: “Şəha”. Ə.Nəvai *(Şərhlər, s.337)* buranın Sənə (Sənə, Sənəndəc) qalası ola biləcəyini yazır. Sənəndəc – hazırda İranın Kürdüstan əyalətinin mərkəzidir.
659 Qara Yusifin oğlu Əbu-Səidin ölümü daha öncə h. 835-ci ilin hadisələri daxilində qeyd edilmişdir.

## 837-Cİ İLDƏ (18.05.1433 – 06.08.1434) BAŞ VERMİŞ HADİSƏLƏR

Bu il İsfahan mirzə Hilləni mühasirə etdi. Əhd-peymandan sonra Əlaüddövlə oğlu Şah Hüseyn qaladan endi. Mirzə İsfahan onu qətlə yetirdi[660].

Bu il Qara Osmanın Mardində məhbus olan oğlu xilas olub o qalanı ələ keçirdi.

### Ölümlər

Xoca Sainəddin Əli Tərkə Heratda vəfat etdi[661]. Ömrü altmış yeddi il idi. Əsərləri: "Şərhi-füsus" ("Füsus şərhi") və "Risalə dər səlat" ("Namaz haqqında risalə").

Həmçinin bu il Şahrux padşahın qulağına çatdı ki, Əmir Seyid Əlinin oğlu Əmir Mürtəza Mazandaranda vəfat etmişdir və məmləkət tamamilə bir-birinə qarışmışdır. O həzrət onun oğlu Seyid Məhəmmədə qayğı göstərib şəfqət etdi və ona atasının yerini verdi[662].

Sahibqiran Əmir Teymur Kürəkanın oğlu Şahrux padşahın oğlu Mirzə Baysunqur bu il sürəkli şərab içməsi səbəbindən ömrünün piyaləsi doldu. Şənbə gününün sübh çağında, cəmadiyüləvvəl [ayının] 7-də (20.12.1433)[663] canını Əzrailə tapşırdı. Şahrux padşah bu hadisədən agah olduqda son dərəcə kədər və həsrətlə mərhum şahzadənin məskəni olan Sefid bağına tələsdi. Onu yuyub kəfənlədikdən sonra elə həmin bağda mərhumun cəsədi üçün namaz qıldılar. Şahrux padşah da orada qaldı. Böyük əmirlər və say-seçmə adamlar tabutu götürüb Məhdi-Ülya Gövhərşad bəyimin mədrəsəsinə apardılar və doğru şəriətin qaydasına, peyğəmbərlərin ağası (Seyyidül-mürsəlin) olan həzrətin (Məhəmməd peyğəmbərin) – ona və nəslinə Allahın salamı olsun – dininin üsuluna görə onu torpağa tapşırdılar. O gün əmirlər, vəzirlər, seyidlər, alimlər, sadə rəiyyət, sıravi xalqın hamısı göy və qara paltar geyindilər. Qəm-qüssənin son dərəcə çox olması ucbatından böyük bir dəhşət və məhşər sübhünün fəryadı zahir oldu. Qırx gün bu minvalla keçdi. Ondan sonra Cəmşid məqamlı padşah xalqı matəm geyimindən çıxarıb libaslarını dəyişdirməyi əmr etdi. Fazillərdən biri Mirzə Baysunqurun vəfat tarixi haqqında demişdir:

Şeir

"Səadətli Sultan Baysunqur səhər vaxtı,
Dedi ki, aləm əhlinə hünərimi söylə!
Mən getdim və vəfat tarixim budur:
Cahanda atamın ömrü uzun olsun!"[664]

Şairlər mərsiyələr deyib ərz etdilər. O cümlədən "Vahidi" təxəllüsünə malik Mövlana Seyfəddin Naqqaş bir tərcibənd demişdir ki, mətləsi[665] belədir:

Beyt

"Ruzigarın dövranında çərxi-fələk elə döndü ki,
Ruzigarın eyvanında vəfa naxışı tapılmaz oldu".

[Bu şeirin] bəndi belədir:

Beyt

"Alicənab şahzadə Baysunqur hanı?
Cəmşidə nə oldu? Əfrasiyab hanı?"

"Rövzətüs-səfa"da[666] qeyd edilib ki, şahzadə Baysunqur yetkinlik yaşına və həddi-büluğa çatdıqdan sonra münəccimlərə ehtiyat nəzəri ilə taleyinin dərəcəsinə baxmağı və ehkam yazmağı buyurdu. Onlar buy-

---

[660] Bu əhvalat daha öncə h. 833-cü ilin hadisələri içində qeyd edilmişdir.

[661] Əslində o, h. 837-ci ildə deyil, h. 835-ci ildə vəfat etmişdir *(Nəvai, şərhlər, s.338).*

[662] Mazandaran hakimləri olan Mərəşi seyidləri sülaləsindən söhbət gedir. Əmir Seyid Əlinin hakimiyyəti 1406-1417, Mürtəzanın hakimiyyəti 1417-1433, Seyid Məhəmmədin hakimiyyəti isə 1433-1452-ci illəri əhatə etmişdir *(Öztürk, şərhlər, s.205).*

[663] Bəzi digər məlumatlara görə, 17-də = 30.12.1433 *(Nəvai, şərhlər, s.339).* Həmin il 20 dekabr bazar gününə, 30 dekabr isə çərşənbə gününə təsadüf etmişdir.

[664] "Bada be-cəhan omr-e deraz pedərəm".

[665] Tərcibənd – klassik Şərq ədəbiyyatında lirik şeir forması. Mətlə – həm günəşin və ya başqa bir ulduzun doğduğu yer mənasında işlədilir, həm də qəzəlin ilk beytini bildirir.

[666] "Rövzətüs-səfa" (tam adı: "Rövzətüs-səfa fi sirətül-ənbiya vəl-müluk vəl-xüləfa", yəni "Peyğəmbərlərin, hökmdarların və xəlifələrin tərcümeyi-hallarına dair saflıq bağçası") – Teymurilər dövrünün saray tarixçisi olan və Mirxond ləqəbi ilə tanınan Məhəmməd ibn Bürhanəddin Xvandşah ibn Mahmudun (1433-1498) dünyanın yaranışından Teymuri hökmdarı Əbu-Səidin 1469-cu ildəki ölü-

ruğa əməl edib, fələyin vəziyyətindən məlum etdiklərini qələmə alaraq ərz etdilər. Mirzə soruşdu ki, "görəsən, mənim ömrüm nə qədər olacaqdır?". Cavabında ərz etdilər ki, "Sizin yaşayış əyyamınız qırx ilə yaxın olacaqdır". Mirzə bu sözdən kədərləndi.

Mirzə Baysunqur eyş-işrətə meyil göstərən bir padşahzadə idi və həmişə fəzilət əhlini himayə edərdi. Türkcə və farsca şeirlər deyərdi. Altı xətt növündə gözəl yazırdı. Onun zamanında şairlər və katiblər əziz və möhtərəm idilər. Onun kitabxanasında gözəl yazan qırx katib vardı və onların öndəri Mövlana Cəfər Təbrizi idi. O mərhumun (Baysunqurun) həyatının müddəti otuz yeddi il və dörd ay olmuşdur. Ondan üç oğul yadigar qaldı: Mirzə Sultan Məhəmməd, Mirzə Əlaüddövlə və Mirzə Babur.

Atası ona üç yüz tümən qəpik tiyul təyin etmişdi. O cümlədən Kaşan, Simnan, Xəbuşan[667], Nisa, Əbivərd, Dehistan, Cürcan və Tus onun ölkəsi idi. Sonra Şahrux onun mənsəbini Mirzə Əlaüddövləyə verdi. Mirzə Sultan Məhəmməd və Mirzə Babur üçün də maaş təyin etdi.

Həmçinin bu il övliyalıq şüarına malik həzrət Əmir Qasım Ənvar vəhşət və qürur məkanından (dünyadan) ülfət və sevinc sarayına (axirətə) köçdü. Ömrü yetmiş iki il idi. Təbrizin Sərabında doğulmuş, Xərgərddə[668] dəfn edilmişdir.

Əvvəllər iradə əlini Həzrət Şeyx Sədrəddin Ərdəbiliyə vermişdi. Bir müddət sonra Şeyx Sədrəddin Əli Yəməninin söhbətinə yetişmiş və o cənaba nisbətdə də ixlas tərzində davranmışdı. Əmir Qasım maddi və mənəvi keyfiyyətlərini təkmilləşdirdikdən sonra ali məqamlı şəxsiyyətinin doğulduğu və boya-başa çatdığı yer olan Azərbaycandan darüssəltənə Herata təşrif gətirmiş, oranı şərəfləndirmişdir. Orada bəndələr firqəsinin irşadı ilə məşğul olmuşdur. Qısa zamanda Xorasanın əksər böyükləri və əyanları o ali məqamlının övliyalıq nişanlı astanasının müridləri cərgəsində qərar tutdular. Onlar onun Kəbəyə bənzər dərgahını özləri üçün müraciət və sığınacaq yeri bilərək gecə-gündüz ixlas qədəmləri ilə onun xidmətinə tələsdilər. O həzrət, Mirzə Şahrux və onun əzəmətli övladları ilə olduqca etinasız danışırdı və şanının ucalığı kamillik dərəcəsində olduğu üçün onlara arzu etdikləri qədər təzim etməzdi və ehtiram göstərməzdi. O səbəbdən Baysunqur mirzənin nurlu qəlbinin haşiyəsinə kədər tozu qondu və öz ürəyində o həzrəti sürgün etmək qərarına gəlib, bunun üçün canının ortasına səy və çalışqanlıq kəməri bağladı. Amma heç bir bəhanə olmadan ürəyindəki arzunu gerçəkləşdirə bilməzdi. Əhməd Lur səadətli xaqan Şahrux padşah həzrətlərinə bıçaq vurduqdan sonra bəlli oldu ki, adı çəkilən şəxs (Əhməd Lur) bəzən o kəramət asimanı günəşinin və imamət bürcü qapıçısının (Qasım Ənvarın) yanına gedərmiş. Mirzə Baysunqur halın keyfiyyətini ərz etdi, Həzrət Əmir Qasım Ənvarı sürgün etməyə icazə aldı və bu məsələni onun ali astanasının xadimlərinə xəbər verdi. Bu səbəbdən o həzrət Mavəraünnəhrə səfər etməyi qərara aldı. Həmin günlərdə bir qəzəl nəzmə çəkdi ki, mətləsi budur:

Beyt

"Ey aşiqlər, ey aşiqlər, elə bir zaman gəldi ki, cahandan,
Ürəyimin quşu uçur göyün yeddinci qatına".

Məqtəsi[669] isə belədir:

"Qasım, sözünü qısa et, qalx və yola çıx,
Tutinin önünə şəkər tök, kərkəsin önünə leş at".

Elə ki Əmir Qasım Ənvar – Allah onun məzarını rəhmət nurları ilə nurlandırsın – mənzilləri və mərhələləri qət edib gözəl Səmərqənd şəhərinin yaxınlığına çatdı, Mirzə Uluğ bəyin əmirləri və sədrləri onun ali hüzuruna gəlib belə bir təlaşa qapıldılar ki, görəsən, nəciblik və ləyaqət sahibi olan həzrətdən (Qasım Ənvardan) mübarək xüsusiyyətlərə malik padşahla görüşmək üçün səltənət bargahına təşrif gətirməyi xahiş etsinlər, yoxsa Uluğ bəyi o tərifəlayiq xasiyyətlinin (Qasım Ənvarın) hüzuruna aparsınlar?! Həzrət Əmir (Qasım Ənvar) Səmərqənd şəhərinə daxil olduqda, təsadüfən onların yolu Ərk qalasının qapısına düşdü. Bildi ki,

---

münə qədər ümumi tarixə həsr etdiyi altıcildlik salnamədir. XVI əsrdə Mirxondun qız nəvəsi Xandəmir bu əsərə 1522-ci ilə qədərki hadisələrdən bəhs edən VII cildi əlavə etmiş, XIX əsrdə isə Rzaqulu xan Hidayət bu salnaməyə daha üç cild artıraraq onu Nəsirəddin şah Qacar zamanının (1848-1896) hadisələrinə kimi davam etdirmişdir *(Ч.А.Стори. Персидская литература, ч. I, с.361-378, ч. II, с.975).*

[667] Xəbuşan – İranda, Xorasan vilayətində, Məşhəddən şimal-qərbdə, Ətrək çayının yuxarı axarlarında və Kopetdağ silsiləsinin ətəklərində yerləşən indiki Kuçan şəhərinin köhnə adı.

[668] Xərgərd – İranın Xorasan vilayətində, Xəvaf şəhristanına daxil olan bir kənd.

[669] Mətlə qəzəlin və qəsidənin ilk beyti olduğu kimi, məqtə də son beytidir.

Mirzə Uluğ bəy oradadır və təklif olmadan qalanın yuxarısına çıxıb o cənabla görüşdü. Mirzə Uluğ bəy müqəddəslər ağasının (Məhəmməd peyğəmbərin) övladlarının öndəri olan bu şəxsin nurlarının feyzinə qovuşduqda onun gövhər açan dilindən dərvişanə sözlər və həqiqət kəlmələri eşitdi. Sonra həmin məclisdə can qulağına iradə halqası taxdı və gözəl əqidə palanını çiyninə saldı. Bir neçə il Əmir Qasım Ənvar mükəmməl cah-calalla o diyarda yaşadı. Həyatının axır günlərində yenidən Xorasanı öz hüzurunun nuru ilə işıqlandırdı.

Bunlar o həzrətin incilər saçan qələmindən çıxmış əsərlərdəndir: "Divani-qəzəliyyat" ("Qəzəllər divanı") – həqiqət mənbəyi olan şeirlərdən ibarət olub, camaat arasında böyük şöhrətə malikdir; bundan başqa, "Ənisül-üşşaq" adlı müxtəsər məsnəvi, insanların ən xeyirlisinin (Məhəmməd peyğəmbərin) övladlarının (seyidlərin) öndəri olan bu şəxsin mənzum əsərlərindəndir. Rəhmli və mərhəmətli Allahın rəhməti və cənnəti ona qismət olsun!

Həmçinin bu il Mirzə İsgəndər bəla əlamətli bir ordu ilə Şirvana yollandı. Əmir Xəlilulla məiyyəti və ordusu ilə Kür kənarında dayanıb Mirzə İsgəndərin çayı keçməsinə mane oldu. Bir neçə gündən sonra Mirzə İsgəndər xəbərsiz şəkildə çayı keçib Şirvan qoşununa həmlə etdi. Əmir Xəlilulla ali məqamlı əmirləri ilə birlikdə özünü Gülüstan qalasına[670] saldı. Mirzə İsgəndər Şirvan əsgərlərindən bir çoxunu qətlə yetirib, Şamaxını qarət edərək Əlincəq qalasına yollandı.

## Ölümlər[671]

Bu il Seyid Nəsimi[672] qətlə yetirildi. Səbəbi budur ki, o, bir cavana müqəyyəd olmuşdu. Bir gün o cavan bir ox atdı. Seyid bu beytləri dedi:

Beyt

"Məni oxunun hədəfi et ki, barı dəvətsiz şəkildə,
Mənə düşsün nəzərin oxun ardınca baxdığın zaman".

Bir gün Hələb üləmasından biri ondan soruşdu:

- Bu cavanın üzündə nə görürsən?

Dedi:

- Onun üzünün aynasında Haqqın surətini müşahidə edirəm.

Beyt

"Məgər onun rüxsarı yeddi ayəli "Fatihə" surəsidir ki,
Onun hər hərfi mənalar dənizidir".

Dedi:

- Biz də onu görürük. Amma o surət bizim gözümüzə dəymir.

Dedi:

- Bu dövlətin (xoşbəxtliyin) Ənqa quşu sizin qabiliyyətinizin Qaf dağını özünə yuva etməmişdir və bu mərtəbənin səadətinin Hümay quşu sizin həşəmət başınıza kölgə salmamışdır.

Seyid Nəsimi ilə o alim arasında bu cür söhbət baş verdikdən sonra o şəxs üləmanın arasına getdi və bunun üzərinə bir neçə yalan xəbər də qoydu. Bir gün seyid bu qəzəli söylədi:

Qəzəl

"Haqqı görən bir nəzər lazımdır ki, sənin üzünü görsün,
Axı xudbin olan bir göz Tanrının üzünü necə görə bilər?!
Könül didara təşnə olanların aynası oldu ki,
Kəlimullah kimi Turda liqa (camal) görsün[673].
Gözü olan kimsə didarının məşriqindən,
Təcəlla nurlarını daim bizi gördüyü kimi görür.

[670] Gülüstan qalası – Şamaxı şəhərinin şimal-qərbində, Qız qalası dağında yerləşən orta əsr qalası. IX əsrdən mövcud olduğu ehtimal edilir. Bu barədə daha ətraflı bax: *H.Ə.Ciddi. Gülüstan qalası. Bakı, 1967.*

[671] H. 837-ci il hadisələri daxilində "Ölümlər" başlığına iki dəfə təsadüf edilir.

[672] Məşhur Azərbaycan şairi Seyid İmadəddin Nəsimi. Digər məlumatlara görə, o, 1417-ci ildə edam edilmişdir.

[673] Kəlimullah – Musa peyğəmbər. Tur – Misirin Sina yarımadasında bir dağ. Dini mətnlərdə Musa peyğəmbərin həmin dağda Allahla danışdığı və Allahın Tur dağına təcəlla etdiyi üçün dağın parçalandığı rəvayət edilir *(İ.Pala. Ansiklopedik divân şiiri sözlüğü. İstanbul, 2007, s.474).*

O üzün və qamətin vəsfi gözəl Allahın gəlişidir,
Amma hər ölü könül bu incə məqamı haradan görsün?!
Ey öz üzü ilə Nəsiminin gözünü açan,
Səni görən kimsə səndən başqasını necə görə bilər ki?!"

O cavan daim Nəsiminin beytlərini oxuyurdu. Onu tutub soruşdular ki, "bu, Nəsiminin şeiridir, ya sənin şeirindir?". Dedi ki, "mənim şeirimdir". Onu dara çəkmək istədilər. Seyid Nəsimi özünü yetirib dedi ki, "bu şeir mənimdir". Ona görə də seyidin dərisini soydular. Dərisi soyulan yerdə o, çox qan itirdi və rəngi saraldı. Dedilər ki, "necə oldu ki, rəngin saraldı?". Dedi ki, "mən eşqin dan yerindən doğmuş aşiqlik səmasının günəşiyəm; günəş batan yerdə saralır"[674].

## 838-Cİ İLDƏ (07.08.1434 – 26.07.1435) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Şirvan valisi Əmir Xəlilulla türkman ordusu o diyarda çoxlu dağıntılar törətdiyi üçün öz mülazimlərindən olan Xaliqverdini Şahrux padşahın dərgahına göndərdi və Şirvanın əhvalının, oradakı sarsıntı və qarışıqlığın şərhini ərz etdi. Bir qasid də Diyarbəkrə göndərdi və Qara Osman Bayandurdan kömək istədi. Ona görə də Əmir Osman çoxlu qoşunlarla hərəkət bayrağını Azərbaycan tərəfə qaldırdı.

O, cah-calalla Ərzurum ətrafına gəldiyi zaman Mirzə İsgəndərin tərəfindən o diyarın valisi olan Pir Əhməd Duxarlu müxaliflik nümayiş etdirib, qala darvazalarını sayıq adamlara tapşıraraq savaş və döyüş qapılarını öz üzünə açdı. Dava-qırğın əsnasında Yaradanın köməyi ilə o qalanın bürclərindən biri çökdü. Çoxsaylı ordu bir anda hücuma keçdi. Xalq şəhəri təslim etdi. Qara Osman o şəhərin idarəçiliyini öz oğlu Şeyx Həsənə tapşırıb onu o şəhərdə yerləşdirdi. Mehtər Bayəzidi isə Şirvan padşahının elçisi ilə birlikdə Gürcüstan yolundan və Gilanın dəniz sahillərindən keçməklə Şahrux sultanın dərgahına göndərdi. Xaliqverdi onlardan öncə çatmışdı. Sonra Mehtər Bayəzid də gəldi və Ərzurumun fəthi xəbərini məruzə etdi. O həzrət sevindi. Ona görə də yeddi ölkənin hökmdarı (Şahrux) lütfkarlıq yüyənini Şirvan valisini himayə etmək və İsgəndər Türkmanı dəf edib qovmaq üçün o tərəfə yönəltdi. Qoşun toplamaq üçün təvaçılar Mavəraünnəhrə, Kaşğara, Bədəxşana, Kabilə, Zabilə, Xarəzmə, Farsa, Kirmana, İraqa və Xorasana yollandılar. Sabit və səyyar göy cisimlərinin sayı qədər həddən və hesabdan artıq bir qoşun cəmləşdi. O həzrət rəbiüssani [ayının] 2-də (05.11.1434) olduqca əzəmət və səadətlə Heratdan çıxıb Azərbaycan tərəfə hərəkət etdi. Əmir Fərmanşeyxi Heratı mühafizə etmək üçün qoydu. Oğullarından cüyür yıxan, aslan ovlayan adlı-sanlı şahzadə Cuki mirzə, böyük əmirlərdən isə Əmir Əlaəddin Əleykə Kükəltaş, Əmir Firuzşah Tərxan, Şeyx Əli Bahadırın oğlu Əmir Yusif Xoca, Kirmandan Əmir Qanaşirin, Yəzddən Əmir Çakmak Şami, Mazandarandan Əmirzadə Əbdülkərim, Fərahdan Şah İsgəndər, İsfahandan Əmir Xavəndşah, Həmədandan Baba Hacı və Şirazdan Mirzə İbrahimin mülazimi Əmir Bəhlul [bu yürüşdə] hökmdarın üzəngisinin mülazimləri cümləsindən idilər.

Rey mahalı dəniz kimi coşan və ildırım kimi gurlayan ordunun dayanacaq yeri olduqda o həzrət soyuğun hücumu səbəbindən Reydə qışlaq etdi. O zaman Qaplan qalasının kutvalı Əbdüləziz Türkman bol peşkəşlə dərgaha gəldi və qalanın açarını təslim etdi. Həmçinin Kağızkonan[675] qalası da fəth olundu.

Şirvan valisi Əmir Xəlilulla tam əzəmət və şövkətlə zilhiccə [ayının] 11-də (08.07.1435) hökmdarın ordusuna qoşuldu. Həmçinin Sultan Qazan, Bayəzid bəy Cagirlü, Ağa Piri, Seyid Əhməd Türk və Yaqub Alpavut kimi Qaraqoyunlunun böyük əmirləri ali taxtın ətəyinə yetişdilər. Şahrux padşah Ağa Pirini, Hacı Məhəmməd Qanaşirini və Yəzd valisi Çakmak Şamini Cahanşah padşahın yanına göndərib onu cahanın pənahı olan dərgaha çağırdı. O zaman Cahanşah Van qalasında idi. Zilhiccə ayının ortalarında (28.06-26.07.1435) o, hökmdarın ordusuna çatdı və padşahanə xələtlərə, daş-qaşlı qılınc kəmərinə, qızıl işləməli geyimə[676], növbənöv lütflərə layiq görüldü.

---

[674] Şairin bioqrafiyası müxtəlif mənbələrin müqayisəli təhlili əsasında S.Şıxıyeva tərəfindən ətraflı surətdə araşdırılmışdır: *S.Şıhıyeva. Nesimî'nin Biyografisinin Yazılmasında Metodolojik İlkeler // Mustafa İsen Adına Uluslararası Sempozyum: Klasik Türk Edebiyatında Biyografi (Bildiriler). Ankara, 2011, s.565-602.*

[675] Kağızkonan – Cənubi Azərbaycanda, Miyanə şəhristanında yerləşən bir bölgənin adıdır.

[676] "Çarqəb" (çaharqəb) adlanan bu geyim Turan sultanları üçün tikilən xüsusi bir geyim növü idi və Sultan Hüseyn Bayqara zamanına qədər qeyri-türklərə bu geyim verilmirdi *(Nəvai, şərhlər, s.353).*

Qış fəsli və havanın soyuqluğu aradan getdikdən və ulduzlar ordusunun sultanı günəş Balıq bürcü qışlağından köçüb Qoç bürcündə mənzil tutduqdan sonra aləmin pənahı olan hökmdar qışlaq yurdundan hərəkət edərək çadır və alaçıqlarının üzünü Azərbaycan tərəfə döndərdi. Qəzvindən, Sultaniyyədən və Zəncandan keçib[677] Ucan çəmənini uğur çadırlarının düşərgəsinə və cah-calal bayraqlarının mərkəzinə çevirdi. Aləmin pənahı olan padşah yayı və tir ayını[678] orada keçirib Azərbaycanın bütün bölgələrini fələk misallı çətirinin kölgəsi altına aldı, o diyara çoxlu daruğalar və məmurlar təyin edərək yolladı. Əlincəq qalasını isə mühasirəyə aldı.

Bu möhnətli xəbər Mirzə İsgəndərin qulağına çatdıqda yerində qərar tuta bilmədi, mətin ayağı sarsıldı və Şirvanı buraxıb Ərzurum yolundan Rum diyarına getmək üçün yola çıxdı. Qeyd olunduğu kimi, həmin vaxt Ərzurum Qara Osmanın əlində idi. Mirzə İsgəndərin fərar etməsi haqqında xəbər qurunun və dənizin hökmdarına yetişdikdə Mirzə Məhəmməd Cukini altmış min süvari və əmirlərdən Yusif Xoca, Əmir Seydi, Əmir Məhəmməd Mirəm və Əmir Baba Hacı ilə birlikdə sürətli yürüş edərək onun üzərinə getməyə göndərdi. Həmçinin Qara Osmanın yanına iş bacaran adamlar göndərib belə işarə etdi ki, gərək yürüşə göndərdiyimiz qoşunun Mirzə İsgəndərə çatması üçün onun yolunu kəsəsən.

O zaman Qara Osman az adamla Kərmək [adlı] yerdə idi. Onun digər çoxsaylı qoşunlarının isə hər dəstəsi Diyarbəkr bölgələrinin birində qərar tutmuşdu. Nurəli bəy, Satılmış bəy, Xəlil bəy və Qütbi bəy Misir sultanının əlində olan Malatyanı mühasirə etmişdilər. Bundan başqa, oğlu Yaqub bəy və onun oğlu Cəfər bəy öz yerlərindən çıxmamışdılar. Əli bəyin qoşunu isə Cahangir mirzə ilə birlikdə Xarputda[679] mövqe tutmuşdu. Sultan Həmzə də Amiddə qalmışdı.

Qara Osman yaşının çoxluğuna, qüvvəsinin zəifliyinə və oğullarının gəlib çatmamasına baxmayaraq, [Mirzə İsgəndərin] qarşısına tələsdi. O, sərdarlar və əyanlarla məşvərət etdi. [Qara Osmanın] oğlu və Həsən padşahın atası olan Əli bəy dedi:

- Yaxşısı budur ki, Ərzurumda yerləşək və arxamızı şəhərə dayayıb öz əhvalımızın qayğısına qalaq ki, cağatay ordusu bizə qoşulsun. Daha sonra isə tez bir zamanda təmkin və vüqarla uğursuzluq əhlini dəf etməyə və onlarla savaşmağa gedərik. Ən doğru tədbir bu olardı.

Amma bu tədbir təqdir edilmədi. Qara Osman bu sözü qəbul etmədi. Bəzi təcrübəsiz və bərkə-boşa düşməmiş cavanlar və bir sıra ehtiyatsız və sınaqdan çıxmamış igidlər söylədilər:

Nəzm

“Nizədən və oxdan söz etmək gərəkdir,
Məkr və hiyləyə nə gərək vardır?!
Əgər bizim qazancımız zəbunluq olacaqsa,
O qazancdansa, bizim yox olmağımız yaxşıdır.
Bir kəs ki, öz başı üçün qorxarsa,
Digərinin başını torpağa necə sala bilər?!
Əli bəyin sözünün bir mənası yoxdur,
O, yetərincə atəş vursa da, tüstüsü çıxmadı.
Onların tədbiri ilə belə qərara alındı ki,
Qətiyyətlə döyüşə atılsınlar!”.

Sonra [Mirzə İsgəndəri] qarşılamağa tələsdilər. O vaxt Mirzə Məhəmməd Cuki, Çoban körpüsünə[680] çatmışdı. Mirzə İsgəndər göröndə ki, adlı-sanlı əmir (Qara Osman) qarşıdurma və müqavimət məqamında ayağını möhkəmlətmişdir, onun qəzəb atəşi alovlandı və səflərini qurmağa başladı. Qoşunlar hər iki tərəfdən hərəkətə gəldilər və bir-birilərinə həmlə etdilər. Atların dırnağından qalxan tozdan günəşin nur bəxş edən gözü örtüldü və ayın səthi məhşər günündə asilərin əməl dəftərinin səhifəsi kimi qara oldu. Küləkdən və tozanaqdan saf hava zəncinin çöhrəsi və həbəşin üzü kimi kimi qaraldı.

---

[677] Paris nüsxəsi: “…Zəncandan keçdi. Qaplan qalasında Mirzə İsgəndər tərəfindən kutval olan Əbdüləziz Kürd qalanı möhkəmləndirdi və igidlər qala üzərinə hücuma keçdilər. Bir az döyüşdükdən sonra orduya qayıtdılar. Ertəsi gün igidlər atlanıb qalaya üz qoydular. Əbdüləziz qalanı təslim edib bəndələr silkində qərar tutdu. Qaplan qalasını Şah İsgəndərə verdilər və Ucan çəmənini…”.

[678] Tir ayı – burada İran günəş təqviminə görə yayın ilk ayı mənasında işlədilmişdir.

[679] Xarput – Diyarbəkrdən şimal-qərbdə, indiki Elazığ şəhəri yaxınlığında, Fərat çayı kənarında tarixi şəhər.

[680] Çoban körpüsü – Ərzurum yaxınlığında, Araz çayı üzərindədir *(S.Eyice. Çoban köprüsü // TDVİA, cilt: 8, yıl: 1993, s.350-351).*

Şeir

“Hava zəncinin üzü kimi qara oldu,
Ölülərin çoxluğundan çöldə yolu görmək olmurdu.
Ulduz nizə idi, günəşsə qılınc,
Yer dəmirdən idi, bulud tozdan idi.
Sanki günəş pərdə arxasında gizlənmişdi,
Yer isə nalların altına girmişdi”.

Döyüş əsnasında Mirzə İsgəndərin əmisi oğlu Qılıc Arslan əsir tutuldu və hər iki tərəfdən bir çoxları qılınc və oxla öldürüldülər.

Şeir

“Gün keçincəyə qədər belə oldu,
Axırda gecənin gəlişi ilə gündüzün ətəyi qısaldı.
Yerdən qaranlıq dənizi çıxdıqda,
Onun içində gündüzün çeşməsi görünməz oldu.
İki qoşun döyüşdən əl çəkdi,
Enişdə və yoxuşda gözətçilər qoyuldu”.

“Rum” (gündüz) bayraqlarının zühurundan “Hind racası”nın (gecənin) bayrağı başı aşağı endi və “Çin şahı”nın (günəşin)[681] aynası bu naxışlı tavana və asılı günbəzə qəndil kimi asıldı.

Şeir

“Çin padşahı üfüqdən Çin aynasını göstərdi,
Səmanın aynasından yox oldu Zəngibar[682] şahının rəngi.
Sənubər kimi xurma ağacı məğribə endi ki,
Səmanın qartalı onu qəfildən ovlamasın.
Fələk sübhün zərli niqabını salladı,
Və səma gəlininin önünə ulduzların qızılını səpdi”.

Qara Osman Bayandur bir dəstə bahadır cavanlarla hərb və savaş əzmi ilə qaladan çıxıb düşmənlərin qarşısında döyüş və vuruş səfi bağladı. O əsnada Qara Osmanın oğlu Məhəmməd bəy və Qutluğ bəy tamam qələbəliklə düşmənlərin mərkəzinə həmlə etdilər və bir çoxlarını kəskin qılınc və can oldayan nizə zərbəsi ilə yaraladılar və öldürdülər. O döyüşdə Mirzə İsgəndər Rüstəmi-Zal kimi qol-qanad açıb, İsfəndiyar[683] kimi iti qılınc zərbəsi ilə Qara Osmanın mülazimlərindən bir dəstəsini həlak torpağı üzərinə saldı. Qandan çölün səthi Ceyhun çayı kimi dalğalanırdı.

O əsnada Qara Osman atdan yıxıldı və başı yaralandı. Ağqoyunlu igidləri hücum çəkib onu ata mindirdilər və Ərzurum şəhərinə qaçdılar. Adlı-sanlı cavanlardan, ali mənşəli əmirlərdən, növrəstə bahadırlardan və qamətli ərlərdən bir çoxları qətlə yetirildilər. Bəziləri isə təqdir pəncəsində əsir oldular.

Beyt

“Mərdliyə bədgüman olmaq lazım deyil,
Çünki sənə uzanır zamanın əli”.

Əli bəy əsirləri xilas etmək üçün bir neçə dəfə geri qayıdıb bir çoxlarını azad etdi və məğlub qoşun Ərzuruma daxil oldu. Qara Osman həmin yara ucbatından fani aləmdən əbədi cahana köçdü. Şeyx Həsən bəy onun cəsədini dəfn etdi.

Qara Osmanın oğulları və qohumları Ərzurum darvazalarını sındırıb fərar etdilər. Şeyh Həsən bəy də şəhərdə qalmadı. Ona görə də Mirzə İsgəndər köç edib Qara Araza[684] getdi. O əsnada Şeyx Həsən bəy də şəhəri tərk edib Mirzə Məhəmməd Cukinin yanına getdi. Mirzə İsgəndər bu xəbərdən agah olduqda Ərzurum

---

[681] Rum əhli ağbəniz, hindlilər qara, çinlilər isə sarı olduqları üçün burada gündüz “Rum diyarına”, qaranlıq gecə “Hind racasına”, sarı günəş isə “Çin şahına” bənzədilmişdir.

[682] Zəngibar – Şərqi Afrikada, Tanzaniyanın materik sahilləri yaxınlarında ada. Bu ifadə də burada qaranığın və gecənin rəmzi kimi işlədilmişdir.

[683] İsfəndiyar – “Şahnamə” qəhrəmanlarından biridir. Qədim İranın yarıməfsanəvi Kəyan sülaləsinin hökmdarı Gəştasbın oğludur.

[684] Qara Araz – Ərzurum şəhərinin 15 km. şimal-qərbində yerləşən və indi Karaz (Qaraz) deyilən bir kənddir *(Öztürk, şərhlər, s.215).*

şəhərinə qayıtdı, Qara Osmanın qəbrini açdırdı və başını bədənindən ayırıb Misir padşahı Sultan Fərəc[685] üçün göndərdi.

Bu əsnada Mirzə Məhəmməd Cuki çatdı. Mirzə İsgəndər Ərzurumu tərk edib qaçdı. Ərzurum şəhəri yüksək şanlı şahzadənin dayanacaq yeri olduqda Qara Osmanın oğlu Əli bəy əksər mülazimlərlə birlikdə orduya qoşuldu. Mirzə Məhəmməd Cuki onu bir sıra cağatay əmirləri ilə birlikdə Mirzə İsgəndərin üzərinə yolladı. Çoxsaylı igidlər Qoyluhisar[686] mövqeyində Mirzə İsgəndərə çatdılar, onun mülazimlərinin bir dəstəsini qətlə yetirdilər və onun ordugahını qarət etdilər. Mirzə İsgəndər az adamla döyüş meydanından çıxıb özünü Rum diyarına saldı. Əsgərlər isə Ərzincana döndülər.

Cuki mirzə Ərzincan hakimliyini Qara Osmanın oğlu Yaqub bəyə həvalə etdi. Ağqoyunlu ulusunun səltənətini isə Qara Osmanın oğlu Əli bəyə lütf etdi, ona qızıl qılınc kəməri və çarqəb bağışlayıb yola saldı. Özü də Qara Osmanın qızı Xanımla evlənib, hökmdarın ordusuna qayıdaraq Qarabağda Şahrux padşahın büsatını öpmək izzətinə nail oldu.

## Müxtəlif əhvalatlar

Bu il Qara Yusifin oğlu Şah Məhəmməd Həmədana yollandı və Baba Hacı onun qarşısına çıxdı. Şah Məhəmməd qaravul dəstəsi ilə irəli gəldi. Şah Məhəmmədə bir ox dəydi və öldürüldü[687].

Bu il Misirdə, Şamda və Rumda taun oldu.

Bu il Gülbirgə padşahı Sultan Əhməd[688] vəfat etdi.

Bu il cəmadiyülaxır ayında (yanvar, 1435) Heratda və ətrafında ("bölükat") taun baş verdi. Bu illət şaban (mart) ayında da tüğyan etdi, şəvvalda (mayda) və zilqədədə (iyunda) o dərəcəyə çatdı ki, bir gündə şəhərdə və ətrafında on min adam vəfat etdi.

## Ölümlər

Mirzə Sultan İbrahim ibn Şahrux padşah ibn Sahibqiran Əmir Teymur Kürəkan Şiraz vilayətində Allahın rəhmətinə qovuşdu[689]. O, səxavətli bir padşahzadə idi, alimlərə və fazillərə çox hörmət edirdi. Şahrux padşah Rey qışlağında bu xəbəri eşitdikdə, üzüntü və iztirabdan sonra yoxsullara və miskinlərə yemək paylatdırdı. Sonra isə Şiraz hakimliyini mərhum şahzadənin azyaşlı oğlu Mirzə Abdullaya verdi.

Mövlana Katibi Məhəmməd ibn Abdulla Turşizdə[690] anadan olmuşdur. Cavanlığının əvvəllərində Nişapura gəlib Mövlana Şeyx Simidən təliq[691] xəttini öyrənmişdi. Ona görə də təxəllüsü Katibi olmuşdur. Ondan sonra Herata yollanmışdı. Mirzə Baysunqur ona əmr etmişdi ki, Kəmaləddin İsmayılın[692] aşağıdakı mətləyə malik qəsidəsinə cavab desin:

Beyt

"Layiqdir ki, taclı gəlsin bostana nərgiz,
Çünki çəmən və bağda mərzbandır nərgiz".

O, buna yaxşı bir cavab söyləyib Şirvana yollandı və "Gül" rədifli qəsidə dedi. Şirvan valisi Əmir Şeyx İbrahim ona on min dirhəm mükafat verdi. Cənab Mövlananın uzun boyu vardı və başına girdə əmmamə taxırdı. Şairlərdən biri onun barəsində demişdir:

"Katibi başına qoyubdur girdə əmmamə,

[685] Burada Sultan Fərəcin adının çəkilməsi yanlışdır. Çünki o zaman Misir padşahı əl-Məlikül-Əşrəf Barsbay (h. 825-842 / 1421-1438) idi *(Nəvai, şərhlər, s.352).*

[686] Qoyluhisar – Türkiyənin Sivas vilayətinin şimalında yerləşən ilçə.

[687] Həsən bəy Rumlu, Şah Məhəmmədin ölümünü daha öncə h. 835-ci ilin hadisələri daxilində qeyd etmişdir. "Mücməli-Fəsihi" əsərinin müəllifi Fəsih Xəvafi isə bu hadisəni h. 836-cı ilə aid edir və onun məlumatı daha dəqiq hesab olunur *(Nəvai, şərhlər, s.353).*

[688] Gülbirgə - Hindistanın Heydərabad şəhərinin qərbində yerləşən bir şəhərdir *(Öztürk, şərhlər, s.217).* Burada Dəkən Bəhməni sultanlarından olan I Sultan Əhməd (1422-1436) nəzərdə tutulur *(Nəvai, şərhlər, s.354).*

[689] O, h. 819 / m. 1416-17-ci ildən etibarən Şiraz mərkəz olmaqla İranın Fars vilayətinin valisi idi *(Nəvai, şərhlər, s.354).*

[690] Turşiz – İranda, Məşhəddən cənub-qərb tərəfdə, Türbəti-Heydəriyyə şəhərindən qərbdə yerləşən şəhər.

[691] Təliq – ərəb əlifbası ilə yazılan əsas bədii xətt növlərindən biri. XIV əsrdə İran xəttatı Salman İsfahani tərəfindən toqi və rüqə xətlərinin əlaqələndirilməsi nəticəsində yaradılmışdır. Kursiv xətti olan təliq sürətlə yazılma xüsusiyyətinə malikdir *(ASE, IX c., s.248).*

[692] Kəmaləddin İsmayıl ibn Məhəmməd İsfahani – XIII əsrin İran şairidir. 635 / 1237-ci ildə vəfat etmişdir. 12 min beytlik divanı vardır *(P.Makulu. Ədəbi məlumat cədvəli. Bakı, 1962, s.192).*

Onun uzun qəddi-qaməti üzərindəki,
Bu dilimli əmmamə bənzəyir,
Minarənin başındakı leylək yuvasına".

Bu il Mövlana Katibi Astarabad bölgəsində taun xəstəliyinə mübtəla olub gücsüzlük yatağına düşdü və ölüm ərəfəsində bu qitəni nəzm edib onu bəyan etmək üçün dilə gəldi:

Şeir

"Vəba qəhrinin atəşindən oldu qəflətən xarab,
O Astarabad ki, onun torpağı müşkdən daha ətirli idi.
Onun içində qocadan və cavandan kimsə sağ qalmadı,
Atəş meşəyə elə düşdü ki, nə yaş qaldı, nə də quru".

Onun şeiriyyatı sırasında bunlar vardir: qəzəllər və qəsidələr divanı, "Mühibb və məhbub", "Nazir və mənzur" mənzumələri.

Musiqişünas Xoca Əbdülqadir Quyəndə[693] müxtəlif fəzilətlər baxımından əvəzsiz idi. Deyirlər ki, Sultan Əhməd Cəlairin zamanında Xoca Rizvanşah böyük şöhrətə malik idi. Onun on iki muğamı, iyirmi dörd şöbəni, qalan üsul və şaxələri və s. nəğmələri və nəqaratları əhatə edən bir ifa tərzi vardı. Xoca Əbdülqadir bir ay ərzində onun cavabını tam şəkildə vermişdi. Xoca bu il Heratda taun xəstəliyindən vəfat etdi.

Qara Osman ibn Qutluq bəy ibn Durəli bəy ibn Pəhləvan bəyin ömrünün müddəti səksən il, səltənətinin zamanı isə otuz iki il olmuşdur. Məməkəti Diyarbəkr idi. Oğullarının adları belədir: Əli bəy, Yaqub bəy, Sultan Həmzə, Qasım bəy, Mahmud bəy, Şeyx Həsən bəy, Murad bəy, İsgəndər bəy və Şəmsəddin bəy.

Onun vəfatından sonra Ağqoyunlular arasında çoxlu qarışıqlıqlar baş verdi. İnşallah, bunların haqqında bəhs ediləcəkdir.

## 839-CU İLDƏ (27.07.1435 – 15.07.1536) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA

Bu ilin əvvəllərində Mirzə İsgəndərin mühüm adamlarından olan Əmir Bayəzid Ayinlü, Şahrux padşaha xidmət etmək üçün ehram bağlayıb, ali taxtın ətəyinə yollanaraq qurunun və dənizin padşahının kimya kimi təsirli nəzəri qarşısına çıxdı. O, şahanə hüsn-rəğbət və xosrovanə mərhəmətlə tay-tuşlarından üstün və seçkin oldu.

Həmçinin bu il Şahəli ibn Şah Məhəmməd ibn Qara Yusif Türkman öz əmisi Mirzə İsfahandan üz döndərib ali taxtın ətəyinə gəldi və tam hörmətlə qarşılandı. Həzrət Şahrux padşah məiyyət və ordu ilə Əlincəq qalasına yönəldi və Mirzə İsgəndərin tikdirdiyi bir neçə imarəti dağıtdı. Sonra döyüşə başladı. Hər iki tərəfdən çox adam qətlə yetirildi. İgidlər ordugaha qayıtdılar. Cahanşah padşah ərz etdi ki, "İsgəndər bəyin hərəmi və onun oğlu, Əbu-İshaq və Əmir Yasaq, arvadının qardaşı Şahəli, vəziri Seyid Mahmud, Aytoğmuş, Seyid Əhməd, Ərəb Əhməd kimi bir sıra əmirlərlə və mən həqirin üç oğlu – Həsənəli, Hüseynəli və Pirbudaqla birlikdə qaladadır[694]; əgər icazə varsa, onları gətirim". O həzrət, Cahanşahı Çakmak və Əmir Qanaşirin kimi əmirlərlə birgə yola saldı. Onlar qala ətrafına çatdıqda iki gün hərb etdilər. Axırda qalanı təslim etdilər. Qalanın yüz qırx beş atdan, səksən tazı itdən və altı qartaldan ibarət mallarına yiyələndilər. Əmirlər mübarək ordugaha yollandılar.

İki aya yaxın idi ki, qoşun Əlincəqdə mövqe tutmuşdu və çoxlu döyüşlər baş vermişdi. Təsadüfən, bir gecə təqribən on altı cəld kişi dağın başına çıxdılar. Səhər çağı qala əhli bundan xəbərdar oldu. Bəzilərini zorla qalaya apardılar. Onların hamısını dağdan aşağı tulladılar və həlak etdilər. [Qaladakılar] çətin vəziyyətə düşmüşdülər və acizlikdən başqa çarə görmədilər. Onlar ali taxtın ətəyinə belə bir ərizə yazdılar: "O xaqan həzrətlərinin səadətli kölgəsi [bizim üçün] dəyərlidir və biz – qadınlardan, uşaqlardan və acizlərdən ibarət bir dəstə adam – bu qaladayıq. Əgər o tərəfdən ağıllı düşüncə və tədbir sahibi olan məhdi-əlanın (padşahın arvadının) – səltənəti əbədi olsun – xas adamları və elçiləri qalamızı şərəfləndirərlərsə, biz onunla əhd bağlayarıq ki, bizim bargahımıza gələrsə, qalanı təslim edərik və o həzrətin adına sikkə kəsdirib xütbə oxudarıq. Onun lütfü artıq olsun!"

---

[693] Məşhur Azərbaycan musiqişünası Əbdülqadir Marağayi nəzərdə tutulur.

[694] Burada söhbət Qəbban qalasından gedir. Belə ki, Əlincə qalası mühasirə altında olarkən Cahanşah, Şahruxa Qəbban qalasının alınmasını təklif etmiş və Şahruxdan hərbi qüvvə alaraq sözü gedən qalanı fəth etmişdi *(İ.Aka. Mirza Şahruh, s.155).*

Xilafətin pənahı olan həzrət və məhdi-əla əmirlərlə məşvərət etdilər. Qərara alındı ki, qalanın fəthi daha əvvəl Əmir Cəlalədiin Çakmak Şaminin rəyi və biliyi ilə baş verdiyi üçün bu sülh də o cənabın qabaqcıl arvadının andı ilə baş tutsun. Möhtərəm və aqil bir qadın olan, öz ağıl, bilik və bacarıq zinəti ilə məşhurlaşan Fatma xatunu Adil Elçi ilə Əlincəq qalasına göndərdilər. Onlar yuxarı qalxdılar. Mirzə İsgəndərin arvadı onları qarşıladı və öz əmirləri ilə birlikdə onlarla əyləşdi. Onlara yaxşı bir qonaqlıq verdilər. Öz qissələrini ərz etdilər. Ondan sonra Mirzə İsgəndərin arvadına və əmirlərə xüsusi xələt geyindirdilər. Mirzə İsgəndərin arvadı əhd-peyman etdi və onlara xələt geyindirib onları peşkəşlə qaladan göndərdi. Onlar hökmdarın ordusuna gəldilər və vəziyyətin şərhini Məlik Həsənə, Əmir Məhəmməd Mirəmə, Əmir Yusif Xocaya  və qalibiyyətli əsgərlərə bildirib Qarabağda məskən saldılar.

Rəbiüssani [ayının] 20-də (12.11.1435) olduqca əzəmət və səadətlə Bərrəkoş mövqeyində qışlaq etdilər. Qaraqoyunlu əmirlərini və cağatay qoşununu Cahanşah padşahla birlikdə Əzəntu qalasına göndərdilər. Çünki Mirzə İsgəndərin hərəmi orada idi. Şahəli bəy Bayrami və Seydi Mahmud bəy qalanı, [Mirzə İsgəndərin] ailəsini və köçünü təslim etdilər. Şahrux padşah, Şahəli bəy Bayraminin bacısını Cahanşah padşaha verdi. Mirzə İsgəndərin digər qadınlarını isə şəriət qaydası ilə evli olmadıqları üçün əmirlərə payladı. Çünki İsgəndər onları nikahsız saxlayırdı.

O zaman Şirvan valisi Əmir Xəlilulla, Şəki hakimi Əmir Əli İnaq və Muğan valisi Əmir Bayəzid Bistam izin alıb öz diyarlarına getdilər. Şahrux padşah o vaxt Hörmüzün[695] vergisini Qarabağa gətirmiş Şeyx Nurəddin Kazerunini Rum padşahı Sultan Muradın yanına göndərdi və ona xəbər verdi ki, "İsgəndər Türkman oğrular kimi qəflətən bizim məmləkətimizin hüduduna gəlirdi və mallar aparırdı; bizim zəfər şüarlı qoşunlarımız o yaramazın üstünə yollandığı zaman isə o, müqavimət göstərməyə taqət gətirməyib qaçmağa üz qoymuşdur. Əgər o hüduda gələrsə, onu tutub ali dərgahımıza göndərərsiniz".

O zaman Gürcüstan hakimi Aleksandr özünün Demetro adlı oğlunu fələk ehtişamlı dərgaha yolladı. Şahrux padşah, Həmzə Məhəmməd Fəzlullanı Gürcüstana göndərdi ki, müsəlman əsirləri gətirsin. Əsirlərin gəlişindən sonra Demetro tam izzət və ikramla öz diyarına yollandı. Əmir Xəlilulla Şirvana yollandıqdan sonra xəbər gəldi ki, onun qardaşları Keyqubad, Fərruxzad, Əbu-İshaq və Haşım Şəki hakimi Əmir Əli İnaqla birləşib Əmir Xəlilullanı Şirvandan çıxarmaq niyyətindədirlər. Ona görə də o həzrət, Əmir Bayəzid Xüttəlanini, Əmir Çakmak Şamini və Əmir Əli Bərəndüqü çoxlu ordu ilə Şirvan padşahına köməyə göndərdi. Xəlilullanın qardaşları Qarasu qalasına[696] sığındılar. İzdihamlı əsgərlər qalanı dairə kimi mühasirəyə aldılar. Onlar öz qardaşları Fərruxzadı bayıra göndərib xahiş etdilər ki, "əmirlər qala ətrafından çəkilsinlər, ondan sonra biz [qaladan] çıxıb sülh bağlayaq". Ona görə də əmirlər köçdülər. Əmir Əli İnaq beş min süvari ilə onlara birləşdi. Əmirlər də geri qayıdıb onların qarşısında mövqe tutdular. Əmir Əli İnaq xəbər göndərdi ki, "Şeyx İbrahim öz sağlığında məmləkəti oğullarına verdiyi halda, Əmir Xəlil onları kənarlaşdırmışdır. Əgər o, məmləkəti qardaşlarına geri versə, sülh və dostluq olar və əgər buna qarşı çıxsa, aralıqda müharibə olacaqdır".

Əmirlər bu xəbəri ali taxtın ətəyinə göndərdilər. O həzrət Əmir Yadigarşah Orlatı əmirlərin köməyinə yolladı. O əsnada Əli İnaq əmirlərin üzərinə gecə basqını etdi. Ağır bir döyüş baş verdi. Əmir Əli İnaqın mötəbər əmirlərindən olan Əmir Mənsur öldürüldü. Elə bu vaxt Əmir Yadigarşah Orlat köməyə çatdı. Əmir Əli İnaq və Əmir Xəlilullanın qardaşı yüz min həsrət və ah ilə meşəyə tərəf fərar etdilər. Böyük əmirlər geri dönüb ulu orduya qatıldılar.

Ondan sonra cahan padşahı Arran Qarabağından Ucan tərəfə hərəkət etdi və o fərəhli məkanda bütün Azərbaycanın hökumət yüyənini Qara Yusif Türkmanın oğlu Cahanşahın iqtidar əlinə verdi. O, hökmdarlara layiq ziyafətlər tərtib edib, padşahanə peşkəşlər verdi. Cəmşid məqamlı şah (Şahrux) darüssəltənə Herata yola düşdü.

Cahanşah padşah öz oğlu Həsənəlini o həzrətin xidmətində qoydu və dedi ki, "mən özüm istədim ki, daima şəxsən hökmdarın üzəngisinin həndəvərində olum; amma o həzrət Azərbaycan əyalətini mən həqirə tapşırdığı üçün bəndənizin oğlu o dərgahın mülazimi olsun".

[695] Hörmüz – İran körfəzi ilə Oman körfəzi arasında, Bəndər-Abbas limanı yaxınlığında ada.
[696] Qarasu qalası – yəqin ki, burada İsmayıllı rayonunun Qarasu dərəsi yaxınlığında yerləşən Qız qalası nəzərdə tutulmuşdur.

O əsnada ərz etdilər ki, bir dəstə türkman Gavərud qalasındadırlar və tacirləri qətlə yetirirlər. Ona görə də o həzrət cah-calalla qala ətrafına gəldi. Qala əhli savaşsız və vuruşsuz qalanı təslim etdi. O həzrət Gavərud əyalətini Baba Hacıya verdi.

## 840-CI İLDƏ (16.07.1436 – 04.07.1437) BAŞ VERMİŞ HADİSƏLƏR

Bu il Ümman dənizi sahillərini, Ərəb adalarını və Hindistan nahiyələrini öz əlində saxlayan Hörmüz hakimi Padşah Seyfəddin öz qardaşı Turanşaha məğlub olub Şahrux padşahın dərgahına gəldi. O həzrət ona himayə göstərib İraq, Fars və Kirman hakimlərinə fərmanlar və hökmlər göndərdi ki, Hörmüzə yollansınlar və o bölgəni Turanşahın əlindən alıb Padşah Seyfəddinə təslim etsinlər.

Ona görə də böyük əmirlər Hörmüz tərəfə yönəldilər. Turanşah ordunun gəlişindən agah olduqda və bəla zəncirlərinin Cərun[697] adasını əhatə etdiyini gördükdə bu hadisədən heyrətə düşüb, tədbir gözəlliyi ilə öz həyat gəmisini bəla burulğanından nicat sahilinə çıxararaq iş bacaran elçilərini bol mallarla ali dərgaha göndərdi və ərz etdi:

- Bəndənizin ata-babaları həmişə o dərgahın fərmanının icraçısı və xərac verəni olmuşlar. Qardaşım Seyfəddin yüksək rütbəli atama qarşı xəyanət etdi və bu diyarı onun əlindən aldı[698]. O, pis xilqətli sultanların üslubu olan zülm və ədalətsizlik qaydasını əldə rəhbər tutdu. Diyarın hər tərəfindən dərdli fəryad səsləri ucaldı. Qorxumuz bu idi ki, o, öz irsi vilayətimizi əlimizdən alacaqdır. Ərəb qəbilələrinin əyan-əşrəfinin köməyi ilə onu bu diyardan qovduq.

Ona görə də Şahrux padşah Tərzək qalası hakimliyini Şah Seyfəddinə verdi və vilayətin qalan hissəsinin Turanşahın əlində olmasını qərarlaşdırdı.

### Mirzə İsgəndərin Rum tərəfdən gəlməsi haqqında söhbət

Rum padşahı Sultan Muradla Qara Yusif Türkman arasında tamamilə dostluq münasibətləri mövcud olduğu üçün Mirzə İsgəndər o diyara çatan vaxt öz qürurunun və nadanlığının çoxluğu ucbatından Rum sultanının yanına bir kimsəni göndərmədi və şəhərləri dağıtmaqla, bəndələrə əziyyət verməklə məşğul oldu. Ona görə Sultan Murad da qəzəbli və kinli bir şəkildə onu dəf etmək üçün böyük (ağır) ordu göndərdi. Mirzə İsgəndər həmin cövşən geymiş ordunun gəlişindən agah olduqda, dərhal Azərbaycan tərəfə tələsdi. Çünki Şahrux padşah çıxıb getmişdi. O, Təcəlliyurdu və Sarıçiçəkdən[699] keçib Malatyaya gəldi. Ağqoyunlu Qılıc Aslan bəylə köhnə dostluğu olduğu üçün onu çağırdı[700]. Qılıc Aslan qardaşları ilə birlikdə Mirzə İsgəndərə qoşuldu və Fərat çayını keçib Xarputun yanında dayandılar.

Xarput hakimi Pəhləvan Seydi Əli, Mirzə İsgəndərin qoşunundan bir çoxlarını qətlə yetirib onların başlarını Qara Osman Türkmanın oğlu Əli bəyin yanına göndərdi. Mirzə İsgəndər Xarputdan köçdükdən sonra Kiğı[701] tərəfə getdi. O diyarı xaraba qoyub, Ərzincan və Tərcana basqın edərək istila bayrağını ucaltdı. Həmin hüdudun və ölkənin ordusunu toplayıb Ərzurum ətrafına gəldi və qalanı ələ keçirdi. Tam əzəmət və şövkətlə Avnik və Kağızman[702] (Qaqızman) yolundan Çuxursəədə və Sürməlüyə gedib [orada] qışlaq etdi. Qardaşı Cahanşah padşah Qızılağacda qışlaq etdi.

### Rum diyarında baş vermiş hadisələr haqqında söhbət

Həmçinin bu il Rum padşahı Sultan Murad hərəkət bayrağını Qaraman vilayətinə tərəf qaldırdı. İbrahim bəy Qaramanoğlu igidlik meydanının bahadırlarından [ibarət] bir dəstə ilə səbat və qətiyyət ayağını möhkəmlədib, igidlik əlini şücaət qolçağından çıxararaq mərdanə səylər göstərsə də, axırda məğlub oldu və fərar yolunu tutdu. Sultan Murad Ağşəhəri və Bəyşəhəri ələ keçirdi. İbrahim bəy Qaramanoğlu boş xəyalları

---

[697] Cərun – İranın cənubunda, Hörmüz boğazında yerləşir.

[698] Seyfəddin öz atası Məlik Qütbəddini hakimiyyətdən uzaqlaşdırıb Keşm və Bərəxs adasında məhbus etmişdi *(Nəvai, şərhlər, s.363)*.

[699] Sarıçiçək yaylağı – Sivasın Divrigi ilçəsi ilə Malatyanın Arapgir ilçəsi arasında yerləşir.

[700] Ağqoyunlu Qılıc Aslanın qardaşı Pir Həsən bəy, Qaraqoyunlu Qara Yusifin zindanında idi və İsgəndər onu azad etmişdi ki, Ağqoyunlu əmiri olmaq iddiası ilə çıxış edən Qılıc Aslanın köməyindən istifadə etsin *(Nəvai, şərhlər, s.364)*.

[701] Kiğı – Türkiyənin Bingöl vilayətinin bir ilçəsi.

[702] Kağızman – Türkiyənin Qars vilayətinin bir ilçəsi.

tərk edib, Rum sultanının dərgahına elçilər göndərərək sülhdən söz açdı. Ona görə də Sultan Murad öz diyarına qayıtdı və kafirlərin əlində olan Büruc qalasını aldı[703].

**Qara Osmanın ölümündən sonra Diyarbəkrdə baş vermiş hadisələr haqqında söhbət**

Qara Osman Ərzurumda qətl olunduğu zaman oğlu Sultan Həmzə Mardin ətrafında idi. O, özünü savaşa yetirmək istədi. Amid ətrafına çatdıqda Qara Osmanın qətli xəbərini eşitdi və həmin şəhəri mühafizə etdi. Ərqəni (Erqani) qalasının kutvalı Tatar ağa, Satılmış adlı şəxsi Əli bəyin oğlu Cahangir bəyin yanına göndərib ərz etdi: "Ağqoyunlu padşahlığı atan Əli bəyə aid olduğu üçün ən tez zamanda buraya gəl ki, sənə itaət palanını çiynimə alıb qalanı sənə təslim edim". Ona görə də Mirzə Cahangir özünü qalaya yetirdi və həmin qalanı tutdu. O əsnada Qara Osmanın oğulları Mahmud bəy və Məhəmməd bəy, arvadı Səlcuq xatun, divan əmiri İbrahim İdris bir dəstə bahadırla Əli bəydən üz döndərib Sultan Həmzəyə qoşuldular. Sultan Həmzə, Şahəli bəy Pornakı şəhərdə qoyub, böyük bir ordu ilə Mardinə yönəldi. Şəhərlilər Əli bəyin yanına söz bilən elçilər göndərib onu Amid tərəfə çağırdılar. Əli bəy üç yüz nəfər yaxşı silahlanmış süvari ilə Amid tərəfə sürətli yürüş edərək özünü şəhərə saldı. Şahəli qaçış yolunu tutdu. Əli bəy Amidin idarəsini oğlu Cahangir mirzəyə tapşırıb özü ulus tərəfə döndü. Digər oğlu Hüseyn bəyi isə dostluq qaydalarını nizama salmaq üçün Misirə yolladı. Sultan Əşrəf[704], Qara Osmandan incik olduğu üçün Hüseyn bəyi həbs edib ordusunun bir qismini Diyarbəkrə basqın etməyə göndərdi. Onlar Qaracadağı soyğun və tarac süpürgəsi ilə silib-süpürdülər. Cahangir mirzə Amiddən çıxıb onlarla döyüşə və vuruşa yollandı. Hərçənd xeyirxah adamlar dedilər ki, "düşmənin üstünə hazırlıqsız getmək məsləhət deyildir və Misir qoşunu çox güclüdür".

Şeir

"Hər nə qədər aslan olsan da, aslan yıxanlardan qorx!
İgid basanla igidlik eyləmə!
Dəmir pəncənə güvənmə,
Çünki dəmiri əridən dəmirçilər var.
Əgər fil olsan da, bədəninin möhkəmliyi ilə öyünmə,
Kərgədanın həmləsindən əmin olma!"

Lakin "qəza gəldiyi zaman bəsirət gözü bağlanır" hökmünə əsasən, onun gözü qürur pərdəsi ilə örtülmüşdü. O, nəsihətçilərin sözünü qəbul etmədi və misirlilərin qarşısında cəsarətlə səf çəkərək bir dəstə bahadırla düşmənin mərkəzinə həmlə etdi. Onları pərən-pərən salaraq, Qaracadağda ələ keçirdikləri malları geri aldı və ağlının, biliyinin "çoxluğu" üzündən qəflət yuxusuna getdi. Misirlilər fürsəti qənimət sayıb bir anda həmlə etdilər və onlar can qorxusu ilə qəflət yuxusundan oyanıb ata mindilər. Böyük bir hərb baş verdi. Misirlilər dörd dəfə Cahangir mirzəni atdan aşırdılar və Ağqoyunlu igidləri onu yenidən ata mindirdilər. Axırda Ağqoyunlu qoşunu məğlu oldu. Mirzə Cahangir bəzi əmirlərlə – Osman bəy Bəktaş, Lələ Həsən və Qara Məhəmmədlə[705] birlikdə əsir alındı. Misir əmirləri onları Sultan Əşrəfin[706] dərgahına yolladılar.

Bu möhnətli xəbər Əli bəyə çatanda pərişan və bədhal oldu. Elə bu vaxt xəbər gəldi ki, Mirzə İsgəndər Rumdan qayıdıb Təcəlliyurdu mövqeyində məskən salmışdır. Əli bəy şahzadələrin toplanması üçün Diyarbəkrin ətrafına qasidlər göndərdi və özü Xarputa gəldi. Yaqub bəy, Piltən bəy, Şeyx Həsən bəy, Mahmud bəy və Məhəmməd bəy bir-birinin ardınca Əli bəyin qoşununa birləşdilər.

Beyt

"Hər tərəfdən gəlib çatdı bir sərvər,
Hər birisi bir qoşunun başçısı".

[703] II Murad Qaraman səfərindən döndükdən sonra, 840 / 1436-cı ildə Evrenosoğlu Əli bəyi Temeşvar üzərinə göndərmiş, növbəti ildə isə özü şəxsən Transilvaniyaya yürüş edərək altı qalanı ələ keçirmişdi *(İ.H.Uzunçarşılı. Osmanlı tarihi, I c., s.363).*
[704] Nüsxələrdə "Sultan Fərəc" yazılıb.
[705] Paris nüsxəsi: "Qara Mahmud".
[706] Nüsxələrdə: "Əşrəf Fərəc".

Əmirzadələrin hamısı ittifaq etdilər ki, Mirzə İsgəndərlə savaşsınlar. Amma Cəfər bəy[707] müxaliflik etməyə başlayıb Kəmaxa və Qarahisara basqın etdi. Ona görə də Ağqoyunlu türkmanları Ərzincana yönəldilər. Bu xəbər Mizə İsgəndərin qulağına çatdıqda, daha öncə qeyd edildiyi kimi, o, Malatyaya yollandı.

## 841-Cİ İLDƏ (05.07.1437 – 23.06.1438) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Mirzə İsgəndər Türkmanın qətli və Azərbaycan vilayətində zamanın hadisələrinin və dövranın çaxnaşmalarının bəziləri

Baharın əvvəllərində gecə ilə gündüz bərabərləşdiyi vaxt Mirzə İsgəndər Türkman böyük əmirlərlə Çuxursəəd və Sürməlü qışlağından çıxıb darüssəltənə Təbrizə yollandı. Qardaşı Cahanşah padşah da Qızılağac qışlağından çıxıb darülirşad[708] Ərdəbilə gəldi və Əmir Bayəzid Bistam və bəzi Şirvan əmirləri ilə ittifaqda Sərab yolundan keçərək hədsiz əzəmət və şövkətlə hərəkət bayrağını Təbrizə doğru qaldırdı. O səadətli hökmdar Mərənd ətrafında dayandı. Mirzə İsgəndər də Təbrizdən döyüş və vuruş əzmi ilə çıxıb Sufiyandakı Həftçeşmədə (Yeddibulaq) dayandı. O əsnada Piri Qaramanlı[709], Mirzə İsgəndərin ona etdiyi yaxşılıqları unudaraq Cahanşah padşaha qoşulmaqla Mirzə İsgəndərin ordusunu viran qoydu. [Mirzə İsgəndər] canının qorxusundan Cuşin[710] yolundan Əlincəq qalasına getdi. Çünki övladları, arvadları və xəzinəsi orada idi.

Cahanşah padşah həmin qalanı mərkəz kimi əhatəyə aldı. Azərbaycanın digər qalalarının kutvalları isə qalaların açarlarını ona təslim etdilər. Mirzə İsgəndərin öz atasının arvadı olan Yaxşının qızından doğulmuş Şahqubad adlı bir oğlu vardı. O da öz atasının Leyli adlı arvadı ilə cinsi münasibətdə olmuşdu. O, anasının vəsatəti ilə həmin Leyli adlı qadınla birlikdə atasını qətlə yetirmək işinə girişdi. İsgəndər öz atasının arvadına tamah saldığı üçün onun öz atasının arvadından elə bir oğlu oldu ki, o da öz atasına qəsd etdi. Belə ki, bir gecə həmin qadın İsgəndərin qılıncını və xəncərini gizlətdi. Əmirlərdən qırx nəfər Şahqubadla ittifaq bağlamışdı. Onlara xəbər verildi ki, indi fürsətdir. İsgəndərin zülmündən cana doymuş və onun cana və namusa qarşı təcavüzündən iyrənmiş qırx nəfərlə birlikdə Şahqubad İsgəndərin yataq otağına tələsdi və onu qətlə yetirdilər[711].

Şeir

“Öz ciyərinin qanı ilə bəslədiyi adam,
Rəhm etmədi və onun ciyərini yırtdı.
Onun ürəyinın və canının rahatlığı olan adam,
Onun ürəyinə və canına rəhm etmədi.
Ömrünün hasilinin hamısı küləyə sovruldu,
Qəmə qərq oldu axır və kədərli getdi.
Çərxi-fələk çoxunun başını yelə verdi,
Nə xoşbəxtdir o kəs ki, anasından doğmayıb”.

Şahsüvar Bayrami və Həsən bəy Ağacəri kimi bir sıra əmirlər də Şahqubadla birləşdilər və onun başçılığını qəbul etdilər, onunla əhd-peyman bağladılar. Şahqubad xəzinəni ələ keçirdi və onun bir qismini qoşuna payladı. Sonra vəziyyətin nə yerdə olduğunu əmisi Cahanşah mirzəyə ərz etdi. Cahanşah padşah bu xəbərə inam və etimad bəsləmədiyi üçün buyurdu ki, “əgər doğru deyirsənsə, qardaşımın ən etibarlı nökəri olan Hələvəri qətlə yetirib başını səltənət taxtımın ətəyinə göndər!”. Yüksək dərəcəli əmisindən bu cür fərman gəldikdən sonra Şahqubad Hələvəri qətlə yetirib, başını kəsərək Cahanşah padşahın dərgahına göndərdi. Şahqubad özü də anasının Cahanşahla evlənəcəyi vədi və əhdi ilə qaladan endi və şərt kəsdi ki, xəzinənin yarısı Şahqubada çatacaqdır[712], həmçinin Avnik qalası ilə Pasin vilayəti ona təslim ediləcəkdir. Cahanşah padşah

---

[707] Cəfər bəy – Qara Osmanın oğlu Yaqubun oğludur. O, öz atasının adından Ərzincanı idarə edirdi *(Nəvai, şərhlər, s.367).*

[708] Darülirşad (ər. “irşad evi”) – Səfəvi şeyxlərinin iqamətgahı Ərdəbildə yerləşdiyi üçün həmin şəhərin adına bu epitet əlavə olunmuşdur.

[709] Paris nüsxəsi: “Pir Məhəmməd”.

[710] Cuşin – İranın tərkibindəki Şərqi Azərbaycan vilayətinin Vərzəqan şəhristanının Xarvana bölgəsində kənd.

[711] İsgəndər yekşənbə gecəsi, 25 şəvval 841-ci ildə (21.04.1438) qətlə yetirilmişdir. Onun cəsədini Əxi Səədəddin qülləsinə gətirib orada dəfn etmişdilər və sonra onun məzarı üzərində bir imarət inşa etmişdilər *(Nəvai, şərhlər, s.369).*

[712] Paris nüsxəsi: “xəzinənin bir qismi Şahqubada çatacaqdır”.

qalanı Pasinlə birlikdə Şahqubadın soyurğalı təyin etdi, amma onun anasını Savalan bəy Ağacəriyə[713] bağışladı. Şamlılar Ərzincanda olduqları vaxt bu xəbərlər Məlik Əşrəfin vəfat xəbərinin ardınca onlara yetişdi.

**Diyarbəkrdə olmuş hadisələr və Qara Yusif Türkmanın oğlu İsfahan mirzənin Qara Osmanın oğlu Sultan Həmzə ilə müharibə etməsi**

Bu il Əli bəy Amidə qayıtdı. Sultan Həmzə Mardindən onun hüzuruna gəldi. Onların arasında qarşılıqlı hörmət və hədiyyələr mübadiləsi baş verdi. Düşmənləri necə dəf etmək yolları barədə məşvərət etdilər. Əli bəy bütün Ağqoyunlu idarəçiliyini ona təhvil verdi. Hərçənd əmirlər bu təhvil-təslim tədbirini pozmağa çalışdılar və söylədilər:

Beyt

“Bir gün birinin atası şah olarsa,
Onun öz başı da tac sevdasından xali olmaz”.

Lakin faydası olmadı. Sultan Həmzə ilə Əli bəy arasında ziddiyyətlərin mövcudluğu [xəbəri] Qara Yusif Türkmanın Bağdad valisi olan oğlu İsfahan mirzəyə çatdıqda[714], çoxlu qoşun toplayıb hərəkət bayrağını Diyarbəkrə doğru qaldırdı. Sultan Həmzə düşmənlərin gəlişindən xəbər tutdu. Öz qoşunlarını yığıb onları qarşılamağa tələsdi. Mirzə İsfahan izdihamlı bir ordu ilə Sincara[715] çatdıqda Sultan Həmzənin üzərinə sürətli yürüş etmək istədi. Axırda bu hərəkətdən vaz keçib Məhmat-bazarı [adlı yerdə] qışlaq etdi.

O əsnada Cəzirə hakimi Abdal bəy və Həsənkeyf hakimi Məlik Xələf gəlib Sultan Həmzəyə qoşuldular. İki aya yaxın o iki ordu bir-birinin qarşısında oturdu. İsfahan mirzənin azuqəsi tükəndiyindən İsa bəylə xəzinədar Həmzəni dörd min süvari ilə taxıl qarət etmək üçün Mardin tərəfə göndərdi. Sultan Həmzə fürsəti qənimət bilib Mirzə İsfahanın üzərinə sürətli yürüş etdi və onun önündə səf çəkdi.

Şeir

“Kosun fəğanı və nəriltisi qalxdı,
Hər iki səfin mərkəzi və cinahı tərtib edildi.
Kos qoşun başçılarının qəmindən,
Vururdu təəssüflə əlini başına”.

Sonra o iki qoşun Əxzər dənizi kimi dalğalanmağa başlayıb bir-birinə qarışdı və elə tozanaq qalxdı ki, şəxslər və nəzərlər arasında pərdələr asıldı.

Şeir

“İgidlərin qanından və qoşunun tozundan,
İtib-batdı yer və mavi göy üzü”.

Sultan Həmzənin sol cinahından Məhmad Həmzə Hacılu, Çələbi Mosullu və Məhəmməd bəy Bəktaş döyüşmək üçün İsfahan mirzənin sağ cinahına həmlə edib onu yerindən dəbərtdilər. Mirzə İsfahanın tərəfindən Tengrivermiş (Tanrıvermiş) və Hacı Mübarək, Sultan Həmzənin sol cinahını məğlub etdilər. Budaq bəy Pornak bir sıra qorxmaz bahadırlarla irəli gedib elə böyük bir savaş etdilər ki, keçmiş zamanda hələ beləsini nişan verən olmamışdı. Çoxlu qırğından və səylərdən sonra Mirzə İsfahan öz oğullarını buraxıb, məyusluq və pərişanlıqla gözlərindən yaş axıdaraq Bağdada yollandı. Sultan Həmzənin əlinə bol mallar düşdü. O, Amid üzərinə hərəkət etdi. Mirzə İsfahanın Mardinə getmiş ordusu isə “Bəsrə xaraba qaldıqdan sonra”[716] ona qoşuldu. Sultan Həmzə çoxlu qoşunla Amid qalasını bir mərkəz kimi əhatəyə aldı. Yetmiş gündən sonra o qalanın tərsa və nəsraniləri (xristianları) qalanı ona təslim etdilər.

Sonra Əli bəyin oğlu Həsən padşah qalanı tərk edib atasının yanına getdi. Sultan Həmzə Amidə yiyələndikdən sonra şəhərin başbilənləri olan Qazı Əhmədlə Hacı Yusifin hər ikisini qətlə yetirdi və əksər rəiyyəti qarət etdi. Lakin xristianlara heç bir vəchlə toxunmadı. Əli bəy öz oğlu Həsən padşahı və Cahangir mirzəni

[713] Bu şəxs adı Sevilən, Sulan kimi də oxuna bilməsinə baxmayaraq, ən doğru oxunuş şəklinin Savalan olduğu təsbit edilmişdir *(F.Sümer. Türk Devletleri Tarihinde Şahıs Adları. I. c. İstanbul, 1999, s.272).*

[714] Paris nüsxəsi: “Sultan Həmzə ilə Əli bəy arasında ziddiyyətin ortadan qalxması xəbəri Qara Yusif Türkmanın Bağdad valisi olan oğlu İsfahan mirzəyə çatdıqda”.

[715] Sincar – İraqın şimal-qərbində şəhər.

[716] Bu, bir zərb-məsəldir və “iş-işdən keçdikdən sonra” mənasını verir.

Misir sultanının hüzuruna göndərdi və kömək istədi. Onlar otu özlərinə döşək, kərpici isə balış edərək böyük bir fəlakətlə Sultan Əşrəflə[717] görüşmək şərəfinə çatdılar.

Sultan qoşun əmiri Tengrivermişi və Misir əmiri, Şam və Hələb naibi Qorxmazı əlli min süvari ilə birlikdə onlara qoşub Diyarbəkrə yolladı ki, Sultan Həmzəni o diyardan çıxarsınlar, Əli bəyi Diyarbəkr səltənətinin taxtına əyləşdirsinlər və daha sonra oradan da Qara Yusifin oğlu Mirzə İsgəndərə verilmiş vədi yerinə yetirmək üçün Əlincəq qalası ətrafına gedib, Cahanşah padşahın mühasirədə saxladığı Mirzə İsgəndəri xilas etsinlər.

Onlar tamam şövkətlə yola çıxdılar. Sultan Həmzə əlacsızlıq üzündən fərar yolunu tutdu. Şam qoşunu sultanın göstərişinə uyğun surətdə Cahanşah padşahı dəf etməyə getmək istədi. Qəflətən Misir tərəfdən xəbər gəldi ki, "Sultan Əşrəf behişt şərafətinə yetişmiş və cənnət bağınının otaqlarına köçmüşdür". Misir qoşunu bu xəbərdən pərişan olub, qorxu-hürküyə düşərək öz diyarına qayıtdı. Cahangir mirzə və Həsən padşah Ərzincanda yerləşdilər.

Misir qoşununun geri dönməsi xəbərini eşidən Sultan Həmzə çoxlu ordu ilə Ərzincana yönəldi. Pir Məhəmməd Pornakı qaravulluğa göndərdi. Həsən padşah onları məğlub edib bir neçə nəfəri qətlə yetirdi. Sultan Həmzə bir mərkəz kimi qalanı mühasirəyə aldı. Bu əsnada Həsən padşah müzəffər bahadırlardan [ibarət] bir dəstə ilə Sultan Həmzənin ordugahına basqın edib hamısını tar-mar etdi və onun xəzinəsini ələ keçirdi. Ona görə də Sultan Həmzə Ərzincan ətrafından köçüb öz diyarına (Diyarbəkrə) yollandı.

## Müxtəlif əhvalatlar

Bu il Rum padşahı Sultan Murad Tuna çayından keçib, Engirüs diyarına gələrək Erdelin[718] altı qalasını aldı və Ədirnədə cümə məscidi bina etdi.

Bu il Təbriz şəhərində taun baş verdi. Ona görə də Cahanşah Türkman Bərdədə qışlaq etdi.

Sultan Yusif Misir əyalətinin taxtına əziz (Yusif peyğəmbər) kimi oturdu. Əhali və rəiyyət ətrafdan təbrik üçün gəldilər. O, hamısına nəvaziş göstərib xələt geydirdi, Misir və Şam ətrafına hakimlər göndərdi və məmləkətin işi onun gəlişi ilə düzəldi. Təqribən dörd ay o diyarda ədalət və insafla rəftar etdi. Ondan sonra yaxınları onu təhrik etdilər və şeytanlığa başladılar, onun ürəyini Sultan Çakmakdan döndərdilər və dedilər:

- Bir halda ki Sultan Çakmak bu cür istiqlala (sərbəstliyə) malikdir, çox keçməz ki, ondan müxaliflik və düşmənçilik hərəkəti baş verər və məmləkət sənin qüdrət və səlahiyyət əlindən çıxar.

Beyt

"Onun əli sənə çatmazdan öncə,
Sən özün özünün fəryadına çat!
Onun işini bitir və asudə ol,
Sərvərlik məkanında rahat ol!
Şahlıq taxtına iki sultan layiqdirmi?
Eyvan tağına iki xaqan layiqdirmi?
Bir evə bir kədxuda bəsdir,
Hər xəstəyə bir dəva bəsdir".

Təklif etdilər ki, onu öldürməsin və məhbus etsin. Bu əhddə möhkəm oldular. Sonra bu fitnəkarlardan biri gəlib bu sirri Sultan Çakmağa söylədi. Sultan Çakmak onu dəf etməyə hazırlaşdı, öz əmirlərindən bəzilərinə paltar altından zireh geydirdi və onları Sultan Yusifin bargahına göndərdi. Sultana macal verməyib onu həbs etdirdi və onun taxtına əyləşdi. Misirin əmirlərini, seyidlərini və qazılarını toplayıb [Sultan Yusifin] xəyanətini hamıya bəyan etdi və dedi:

- Onun atasının vəsiyyətinə əsasən iş görəcəyəm. Onu öldürməyəcəyimə dair and içdiyim üçün onu sadəcə həbs edəcəyəm.

Əmirlər ona dua etdilər. Sultan Çakmak üçün xəzinədən misirlilərin adətinə uyğun bir qılınc gətirdilər. Bu, Məlik Zahirin qılıncı idi və onun üzərinə Məlik Zahirin adını həkk etmişdilər. Sonra Sultan Çakmak

[717] Nüsxələrdə: "Fərəc Əşrəf".
[718] Erdel – Transilvaniya *(Nəvai, şərhlər, s.373).*

Yusif səltənətinin taxtında qərar tutdu. O, Misir və Şam əmirlərinə, rəiyyətinə və əhalisinə nəvaziş göstərdi, Yusifi məhbus etdi və ədalətlə, insafla iş görməyə başladı. Əmirlər, vəzirlər və əhali Yusifin xəyanətindən agah oldular və Misir səltənəti ona (Çakmağa) aid oldu.

Yusifin həbsindən iki həftə keçəndən sonra bir dəstə qulam onu həbsdən xilas etdi. O, Misirdə gizləndi. Məlik Zahir[719] bunu eşitdikdə onu axtarmaq üçün adamlar təyin etdi. Onu tapa bilmədilər. Sonra başqa bir dəstəni təhdid və xəbərdarlıqla göndərdi. Onlar onu tapıb Məlik Zahirin yanında məhbus etdilər. Daha sonra İsgəndəriyyəyə göndərdilər və onun xərcləri ("ixracat") üçün min flori[720] təyin etdilər.

**Qorqutmuşun Misirə gəlməsi, onun Məlik Zahirə qarşı müxaliflik etməsi və həbsə alınması haqqında**

Əmir Qorqutmuş, Sultan Əşrəfin böyük əmiri idi. O, bütün Şamı öz əlində saxlayırdı. Sultan Yusifin həbsi və Məlik Zahirin səltənəti xəbəri ona məlum olduqda hədsiz bir qoşunla Misirə hərəkət etdi. O, bahadır əmirlər zümrəsindən idi və çoxlu şücaətlər göstərmişdi. Bir neçə dəfə Sultan Əşrəfə qarşı üsyan qalxdıqda məhz o getmiş, qalib gəlmiş, Qara Osmanın [oğlu] Habili tutmuş, Birəni və Hermus[721] adasını almışdı. Onun xəbəri Məlik Zahirə çatdıqda öz oğlu Əbu-Məhəmmədi bütün əmirlərlə onu qarşılamağa göndərdi və ən mükəmməl hörmət-izzətlə onu öz bargahına gətirib öz yanında yer verdi. Əmirləri, əhalini və qazıları topladı, Sultan Yusifin xəyanətini Əmir Qorqutmuşun yanında açıqladı. Sonra Məlik Zahir, Əmir Qorqutmuşa dedi:

- Ey əmir! Səltənət sənə yaraşır və sənə layiqdir. Sən bütün hallarda böyük əmirsən və əmirlərin öndərisən. Mən də Sultan Əşrəf zamanında malik olduğum vəzifəyə qaneyəm. Səltənəti qəbul et!

Qorqutmuş dedi:

- Səltənət sənindir. Sultan Əşrəf məmləkəti sənə vermişdi və bütün camaat səndən razıdır və məmnundur.

Misir seyidlərinin, əhalisinin və qazılarının hüzurunda Qorqutmuş and içdi ki, Məlik Zahirə sadiq olacaq. Məlik Zahir üç yüz min flori və yüz baş at Qorqutmuşa peşkəş etdi və onun əmirlərinə xələt geyindirdi. Qorqutmuş öz məkanına geri döndü.

Onun əmirləri və yaxınları gecə vaxtı toplaşıb onu yoldan çıxarmağa başladılar. Qorqutmuş cavab verdi:

- Mən ona sadiq olacağıma and içmişəm, əhd bağlamışam və beyət etmişəm. İndi bunu necə pozum?

Cavabında dedilər:

- Təlhə və Zübeyr[722] kübar səhabələrdən olduqları halda, Əmirülmöminin Əliyə – Allahın salamı olsun ona – etdikləri beyəti pozdular və Bəsrəyə getdilər. Əgər sən də əhdini pozsan, nə olacaq ki?!

O qədər belə sözlər söylədilər ki, o usandı və onlara dedi:

Beyt

"Hər kim öz əhdinə vəfa etməsə,
Özünə cəfadan başqa bir şey etməz".

Lakin o qədər təkid etdilər ki, axırda Qorqutmuş əhdini pozdu və müxaliflik qurşağını bağladı. O gecə keçdi.

Beyt

"Parlaq günəş peyda olduqda,
Gecənin kölgəsi getdi, aydın sübh oldu.
Qorqutmuş döyüş paltarını geydi,
Öz pəhləvanlarının hamısını cəmlədi.
Hamısı dəmirə qərq olmuş, nizə tutmuşdular,
Hamısı şikar gününün aslanları kimi idilər.

---

719 Çakmak hakimiyyətə gəldikdən sonra Məlik Zahir adını almışdı.
720 Flori (florin) – 1252-1533-cü illərdə İtaliyadakı Florensiya şəhər-dövlətinin 3,5 qr. çəkisində qızıl sikkəsi.
721 Paris nüsxəsində: Qıbrıs (Kipr).
722 Təlhə və Zübeyr – Məhəmməd peyğəmbərin səhabələrindən və islam sərkərdələrindən olmuş, lakin Həzrət Əli xilafət rəhbərliyinə keçdikdə, onlar peyğəmbərin dul qadını Aişəni də özlərinə müttəfiq edərək Həzrət Əliyə qarşı qiyam qaldırmışdılar. Nəticədə, 656-cı ilin dekabrında Bəsrə şəhəri yaxınlığında baş vermiş Cəməl döyüşündə Təlhə və Zübeyr qətlə yetirilmişdi.

Yüksəldi hər tərəfdən hay-huy səsləri,
Qala səmtinə üz qoydular şəhərdən".

Qorqutmuş polad geyimli üç min süvari ilə atını yəhərlədi və əlində düz nizə tutub Misir qalasının həndəvərinə gəldi. Qalanın yanında səf çəkdilər. Misirin qara camaatından təqribən iki min nəfər onlara qoşuldu və qalanın qapısına gəldilər. Məlik Zahir işin bu yerdə olduğunu gördükdə darvazanın üstünə çıxıb dedi:

- Ey Qorqutmuş! Mənimlə əhd bağladın və and içdin. Mən səltənəti həvəs və rəğbətlə sənə verirdim. Amma sən qəbul etmədin, sonra isə öz andına xilaf çıxdın.

Qorqutmuşun qoşunu qalaya oxdan savayı heç bir elçi göndərmədi və iti süngüdən başqa bir çarə bilmədi. Məlik Zahir nəzər saldı. Qalada beş yüzdən artıq qulam yox idi. Məşvərət etdilər ki, "[qaladan] çıxaq və onların üstünə hücum edək; əgər biz üstün gəlsək, dövlət bizim olar və əgər onlar qalib gəlsələr, biz məmləkəti ona verərik". Məlik Zahir dedi ki, "[qaladan] çıxmaq doğru deyildir". O, nəzir etdi ki, əgər salamat qalsa, Məscidül-Həramı[723], Peyğəmbər məscidini[724], Qüds məscidini və Xəlil məscidini[725] təmir edəcəkdir. Onun buyruğu ilə xəzinədən flori ilə dolu bir neçə kisə çıxarıb onları qala divarının üzərinə qaldırdılar və bir kisənin ağzını açıb qalanın arxasından aşağı tökdülər. Qalanın arxasındakı adamlar onu yığmağa başladılar və hay-küy qalxdı. Daha bir kisəni tökdülər. Qapının ağzındakı adamlar da xəbərdar olub flori yığmaqla məşğul oldular. Məlik Zahir beş yüz qulamla qalanın qapısını açıb bayıra çıxdı və Qorqutmuşa hücum edib onun adamlarını pərən-pərən saldı. Qorqutmuş məğlub oldu. Onun adamları qaçış yolunu tutdular. Qorqutmuş Bərəkətül-filə[726] gedib gizləndi. Adamlar onu axtarmaq üçün yola çıxdılar. O isə Bərəkətül-fildə idi. Himayə və dəstək üçün, orada olan Məlik Zahirin oğlu Əbu-Məhəmmədə pənah apardı. O, Qorqutmuşu atasının yanına gətirdi. Məlik dedi:

- Səni haqqın kəlamı tutdu ("Quran" sənə qənim oldu). Çünki ona and içdin və əhdini yerinə yetirmədin.

Onu da bağlayıb İsgəndəriyyə tərəfə göndərdi. Maliki məzhəbinə əsasən fitva verdilər ki, yalandan and içən hər kəs ziyankardır, islamdan üz döndərmişdir və onun qətli vacibdir.

Sonra onu İsgəndəriyyədə qətlə yetirdilər və bütün Misir və Şam maneəsiz, əngəlsiz və müxalifsiz şəkildə Məlik Zahirin ixtiyarına keçdi. 843-cü il (1439-40) gəldiyi zaman Məlik Zahir nəzir etdiyi kimi Məscidül-Həramı, Mədinə məscidini, Əqsa məscidini[727] və Xəlil məscidini təmir etməyin tədarükünü gördü.

## Ölümlər

Sultan Əşrəf Fərəc ibn Bərqüq[728] bu il hərəkət bayrağını axirət tərəfə qaldırdı. O, adil və yaxşı xasiyyətli bir padşah idi. Səltənətinin müddəti qırx il olmuşdur. Məmləkəti Misir, Şam və Hələb idi. Məkkə və Mədinədə də sikkə onun adına idi. Onun ölümündən sonra Misir əmirləri əmiraxur Çakmak bəyi səltənətə əyləşdirdilər və ona Məlik Zahir adı qoydular.

Hələb hakimi Tengrivermiş müxaliflik etməyə başladı. Hələb camaatı onu daşqalaq edib əksər mülazimlərini qətlə yetirdilər və o, fərar yolunu tutdu. Hələb çevrəsindəki əşirətlər onunla ittifaq etdilər. O, yenidən fitnə-fəsad çıxardı. Bu əsnada Şam naibi İnal da müxaliflik etməyə başladı. Sultan Çakmak yaraqlı ordunu onu dəf etməyə yolladı. Onlar İnalı qətlə yetirib başını Misirə göndərdilər və oradan Hələbə yola düşdülər. Asi-su[729] mövqeyində Tengrivermişlə döyüşdülər. Tengrivermiş öldürüldü və onun fitnə-fəsad atəşi söndü.

---

723 Kəbə məscidi.
724 Mədinə şəhərindədir.
725 Fələstindədir.
726 Bərəkətül-fil – Qahirə yaxınlığında bir göl *(A.Cevad. Memalik-i Osmaniye'nin tarih ve coğrafya lugati. I c., İstanbul, 1313, s.169).*
727 Əqsa məscidi – Fələstinin Qüds şəhərində yerləşən müqəddəs məscid.
728 Buradakı Fərəc ibn Bərqüq ifadəsi artıqdır və yanlışdır. Onun adı əl-Məlikül-Əşrəf Əbu-Nəsr Barsbay idi. Fərəc ibn Bərqüq isə h. 801-808-ci (m. 1398-1405) illərdə Misir və Şam sultanı olmuşdur *(Nəvai, şərhlər, s.377).*
729 Asi-su – Suriyadakı Nəhrül-Asi (Asi çayı) nəzərdə tutulur. Avropalılar ona Orontes deyirlər. "Əhsənüt-təvarix"də isə Asi çayının adına türkcə "su" sözü artırılmış və Asi-su şəklində yazılmışdır *(Nəvai, şərhlər, s.378).*

Həmçinin bu il Baba Hacı bəy Həmədanda vəfat etdi. Qara Yusifin oğlu Şah Məhəmməd onun əli ilə öldürülmüşdü. Neçə il sultanlara qarşı müxaliflik etmiş Sədrəddin Dərcəzini də onun fərmanı ilə qətlə yetirilmişdi. O, Şəhristan kimi məşhur olan və Səlcuqilər zamanında dağılmış Həmədandakı ağ köşkü abadlaşdırmış və təmir etdirmişdir. Şahrux padşah Həmədanda olduğu vaxt oranı onun oğlu Əbu-İshaqa[730] verdi.

## 842-Cİ İLDƏ (24.06.1438 – 13.06.1439) BAŞ VERMİŞ HADİSƏLƏR

Bu il Cahangir mirzə və Həsən padşah Misirə yollandılar. Sultan onlara ehtiram göstərib üç min əşrəfi[731] ilə dəyərli xələtlər və qızıl qılınc kəməri də hədiyyə etdi və onları Diyarbəkr tərəfə göndərdi. Bu xəbər Sultan Həmzəyə çatdıqda çoxlu ordu ilə Birəcük qalasını bir mərkəz kimi əhatəyə aldı.

Bu il Həsən padşah Sultan Həmzənin ordusunun ətrafına gəlib gecə basqını etdi və onun bir dəstə adamını qətlə yetirib çoxlu mallar apardı. Sultan Həmzə qala ətrafından köçüb öz diyarına yollandı.

Həmçinin bu il Sultan Murad Semendire[732] vilayətini fəth edərək Ədirnəyə qayıtdı.

Bu il Cahanşah padşah Kürdüstana basqın etdi.

## 843-CÜ İLDƏ (14.06.1439 – 01.06.1440) BAŞ VERMİŞ HADİSƏLƏR

Bundan öncə qeyd edildi ki, Misir və Şam hakimi Sultan Əşrəf[733] hərəkət bayrağını axirət tərəfə qaldırdı. Ondan sonra əmiraxur Çakmak bəy onun yerini tutdu. Sultan Əşrəfin hakimiyyəti dövründə Çakmak bəy bir gecə yuxuda gördü ki, Şahrux padşah onun belini tutub səltənət taxtına əyləşdirir. Yuxudan oyandıqda öz-özünə qərar verdi ki, əgər yüksək hökmdarlıq mərtəbəsinə çataramsa, Şahrux padşahın dərgahına yaxşı töhfələr göndərərəm. Elə ki ayağını hökumət kürsüsünə basdı, bu səbəbdən Çiçək Buğa adlı elçisini aləm sakinlərinin hökmdarının dərgahına göndərdi. Elçi bu il Herata çatdı və əmirlərin vasitəçiliyi ilə hüzura çıxmaq şərəfinə nail oldu. Peşkəş kimi gətirdiyi hədiyyələri təqdim etdi. Padşah ali bir məclis tərtib etdi. Belə ki, süfrələr tamamilə qızılı idilər, kasalar da qızıldan idilər və əksəri daş-qaşla bəzədilmişdilər. Həmçinin qızıl və gümüşdən düzəldilmiş böyük tabaqların sayı-hesabı yox idi. Çiçək Buğa ərz etdi ki, "Sultan Çakmak yeddi ölkənin padşahından (Şahruxdan) beş mötəbər kitab istəmişdir və adları bunlardır: Şeyx Əbu-Mənsur Maturidinin "Təvilati-hüccəti-əhli-sünnət" ("Sünnilərin dəlilinin izahı"), Əllamə Razinin "Təfsiri-kəbir" ("Böyük təfsir"), Şafei[734] məzhəbi haqqında "Şərhi-rövzə" ("Cənnət şərhi"), Xoca Məsud Buxarinin yazdığı "Şərhi-təlxisi-came" (Məcmunun xülasəsinin şərhi") və Mövlana Əlaəddin Pəhləvanın "Şərhi-kəşşaf" ("Kəşşaf şərhi") əsərləri".

Bu kitabların hamısı hökmdarın kitabxanasında mövcud olsa da, o həzrət buyurdu ki, hər beş kitabı yaxşı xətlə yazıb elçi Çiçək Buğaya təslim etsinlər. Bundan başqa, Sultan Çakmak üçün padşahanə hədiyyələr və hökmdarlara layiq bəxşişlər təyin etdi. Elçiyə əlli min dinar məbləğində nağd [pul] verdi. Onun əlli nökərinə at və paltar bağışladı. Gizli qalmasın ki, dinarlar qırmızı qızıldan ibarət idilər.

Məlik Çakmağın fərmanına əsasən, elçi İsfahan, Şiraz və Yəzd tərəflərdən keçib getmək istəyirdi. O həzrət o vilayətlərə adamlar göndərib xəbər verdi ki, elçinin gəldiyi zaman şəhəri bəzəsinlər və hər şəhərdən ona əlli min dinar versinlər. [Şahrux] Mövlana Hüsaməddin Mübarəkşah Pərvanəçini elçilərlə birlikdə Misir tərəfə yolladı. Amma yol əsnasında o, axirət aləminə köçdü. Sözügedən hədiyyələri isə onun oğlu Misirə çatdırdı və hörmətlə, izzətlə Herata qayıtdı.

---

[730] Bu şəxsin oğlu Əbu-İshaq deyil, Hacı Hüseyndir *(Nəvai, şərhlər, s.379)*.

[731] Əşrəfi – çəkisi 3,45 qr. olan qızıl sikkə. 1422-1438-ci illərdə Misirdə Məmlük sultanı Əşrəf Seyfəddin Barsbəy tərəfindən kəsilmiş və onun adı ilə adlandırılmışdır. Azərbaycan Səfəvilər dövlətində kəsilmiş müvafiq çəkili qızıl sikkələr də əşrəfi adlanırdı.

[732] Semendire (Smederevo) – Serbiya knyazlığının paytaxtı idi. Bu şəhər Dunay çayı sahilində, Belqraddan cənub-şərqdə yerləşir *(Nəvai, şərhlər, s.381)*.

[733] Nüsxələrə: "Əşrəf Fərəc ibn Bərquq".

[734] İslamın sünni cərəyanının 4 əsas məzhəbi vardır və bu məzhəblər öz banilərinin adları ilə adlanırlar: Hənəfi, Şafei, Maliki və Hənbəli.

### Müxtəlif əhvalatlar

Həmçinin bu il Rum padşahı Sultan Murad çoxlu ordu və saysız güruhla Belqrad tərəfə yola düşdü. O diyarın qalasını mühasirəyə alsa da, fəth edə bilmədi və geri qayıdıb Novoberda[735] qalasına yönəldi. Oranı ələ keçirdi və Rumeli əmirülüməarası İshaq paşanı Bolunu[736] fəth etməyə göndərdi.

Həmçinin bu il Mövlanazadə Əbhəri kimi məşhur olan Mövlana Əbdüləziz Həccə yollandı və yol əsnasında, rəcəb ayında (08.12.1439-06.01.1440) əbədiyyət aləminə köçdü.

Həmçinin bu il Cahanşah padşah Lori qalasını[737] tutub fəth etdi.

### 844-CÜ İLDƏ (02.06.1440 – 21.05.1441) BAŞ VERMİŞ HADİSƏLƏR

Bu il Əli bəyin oğlu Cahangir mirzə Ərqənin (Erqani) vilayətini qarət etdi. Onun ardından böyük bir qoşun gəlib çatdı. Ağır bir müharibə baş verdi. Axırda Cahangir mirzənin qoşunu qalib gəldi. Sultan Həmzə də Ruha (Urfa) qalasını əhatəyə aldı. Həsən padşah qaladan çıxıb Sultan Həmzənin min nəfərdən ibarət mülazimləri ilə gərgin bir döyüş apardı. Ona görə də Sultan Həmzə geri dönüb Ərzincana getdi. Şəhərlilər şəhəri ona təslim etdilər. Oradan Mardinə yola düşdü.

O əsnada Həsən padşah üç yüz nəfərlə onların qarşısına tələsib mərdliklə döyüşdü. Müxaliflər onu atdan salsalar da, başıaçıq halda yenidən ata minib onlardan bir nəfəri qətlə yetirərək geri döndü. Sultan Həmzənin qoşunu Mardin vilayətini qarət edib öz diyarına qayıtdı.

### Müxtəlif əhvalatlar

Bu il Astarabad tərəfdən külək kimi sürətli bir qasid gəlib ərz etdi ki, "Dəşt (Dəşti-Qıpçaq) tərəfdən özbək qoşunu o məmləkətə daxil olmuş və Əmir Yusif Hacı Cəlil qətlə yetirilmişdir". Bu sözün şərhi belədir ki, özbək qoşununun bir dəstəsi qazaq[738] olub Mazandaran vilayətinə gəlirdi və hər yerə əl uzadıb (qarət edib) geri dönürdü. Həzrət Şahrux padşah hökm etmişdi ki, hər il bir neçə tümən əmiri Mazandaran vilayətinə gedib o hüduddan xəbərdar olsun və o məmləkətdə qışlaq etsin. Bir neçə kərə Mirzə Baysunqur və ondan sonra Mirzə Əlaüddövlə dəfələrlə orada qışlaq etmişdilər. Bu il Əmir Hacı Yusif Cəlil[739], onun qardaşı Əmir Şeyx Hacı və bir neçə digər tümən əmiri o sərhədi mühafizə etməyə təyin olundular. Tümən əmirlərinin hər biri öz qoşunu ilə o vilayətə yetişdi və gecəni-gündüzü ehtiyatla keçirdilər. Qəflətən özbək ordusu əmirlərin üzərinə elə basqın etdi ki, onların qoşununu bütünlüklə pərişan etdi. Əmir Hacı Yusif Cəlil səbat və qətiyyət ayağını möhkəmlədib cəsarət əlini şücaət qolçağından çıxardı, bahadırcasına həmlələr və igidcəsinə hücumlar həyata keçirdi. Onun adamları çox az olduqlarından onun böyük səyləri fayda vermədi. Döyüş əsnasında təqdir kamanından çıxmış bir ox onun can alan yerinə dəydi və o, şəhid oldu.

Bu il Cahanşah padşah Azərbaycandan Gürcüstana yollandı. Qars[740] səhrasında üç gün məskən saldıqdan sonra Şəkiyə və Tiflisə basqın edib, otuz min əsirlə Gürcüstandan çıxaraq Azərbaycana tərəf qayıtdı.

Bu il Seyid Mürtəza Möhtəsib[741], Şahrux padşaha ərz etdi ki, "bu sədaqətli xidmətkarınız, ali dərəcəli şahzadələr olan Cuki mirzənin və Əlaüddövlənin şərab küplərini sındırmaqdan acizdir". Şahrux padşah ata minib, harada şərab gördüsə, onu torpağa tökmələrini əmr etdi.

---

[735] Novoberda – Kosovnın şərqində qəsəbədir.

[736] Bolu – Türkiyənin Ədirnə şəhərindən şimalda, indiki Bolqarıstan ərazisində yerləşən Yambol şəhəri nəzərdə tutulur. Osmanlı dövründə bura Yanbolu adını daşıyırdı.

[737] Lori – indiki Ermənistanın şimalında, Samtsxeti silsiləsindən cənubda, Debed çayının sahilində, tarixi Borçalı mahalının ərazisində yerləşən qala.

[738] Qazaq – zahirən bu kəlmə dağlarda və çöllərdə basqınçılıq edən və sərgərdan həyat tərzi keçirən macəraçı adamlar mənasında işlədilirdi. Bu ifadə Zəndlər zamanına qədər həmin anlamda istifadə edilirdi *(Nəvai, şərhlər, s.386).*

[739] Paris nüsxəsində Cəlil əvəzinə Xəlil yazılmışdır.

[740] Qars – Türkiyənin şimal-şərqində şəhər.

[741] Möhtəsib – şəhər bazarlarına nəzarət edən, malların qiymətini təsdiqləyən dövlət məmuru. Hər bir şəhərdə möhtəsiblər olurdu və onlar baş möhtəsibə, yəni möhtəsibül-məmalikə tabe idilər (bax: *О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.267-268; З.Г.Байрамов. Местное и городское управление в Азербайджане, с.19-20*).

**Ölümlər**

Həmçinin bu il yaşı doxsanı adlamış Əmir Əlaəddin Əleykə Kükəltaş vəfat etdi. O, ədalətli və xeyirxah bir əmir idi. Onun bir ildə əkdiyi toxumun miqdarı yüz min xərvarı keçmişdi.

Şeir

“Səkkiz yüz qırx dörddə,
Böyük bir hadisə oldu.
Mərhum Əlaəddin Kükəltaş,
Behişt tərəfdə kamil bir əmir oldu.
Cəmadiyüləvvəlin 18-də (15.10.1440),
Bu cahandan köçdü təcili.
Cümə günü bu torpaq saraycıqdan ayrıldı,
Əbədi cənnətdə mənzil eylədi”.

Qara Osman Bahadırın oğlu Sultan Həmzə də bu il Amiddə axirət aləminə yollandı. O, zalım bir padşah idi, keşişlərə çox hörmət göstərirdi və onlarla görüşərkən ayağa durardı. Lakin islam üləmasına əsla iltifat və ehtiram göstərməzdi. Belə ki, məscidin və müsəlman məktəbinin qapısından keçərkən onların “Quran” oxumaqla məşğul olduqlarını gördüyü zaman söyləyirdi ki, “elm və “Quran”ın bina etdiklərini mən yıxdım, bunlar isə hələ də onunla məşğul olurlar”.

Onun ölümündən sonra nökərlərindən bəziləri Cahangir mirzəni Amidə çağırdılar. Bəziləri isə Şeyx Həsən bəyi dəvət etdilər. Cahangir mirzə daha öncə gedib şəhəri ələ keçirdi.

Qara Osman Türkmanın oğlu Əli bəy də bu il Hələbdə əbədiyyət aləminə köçdü. Üç oğlu vardı: Cahangir mirzə, Həsən bəy və Hüseyn bəy[742].

## 845-Cİ İLDƏ (22.05.1441 – 11.05.1442) BAŞ VERMİŞ HADİSƏLƏR

Sultan Həmzə vəfat edən zaman qardaşı Şeyx Həsən bəy onun tərəfindən Ərzincan hakimi idi. Ağqoyunlu əmirlərinin bəziləri Cahangir mirzədən uzaqlaşıb ona qoşuldular. Cahangir mirzə pornak [tayfasının] əmirlərindən Şahəli bəyi həbs etdi və qışlağa döndü. Piltən bəy, Cahangir mirzə ilə əhd bağladıqdan sonra öz əhdini pozub Şeyx Həsən bəyin tərəfinə keçdi. Qəsd etdilər ki, Kəmaxı mühasirəyə alsınlar. Çünki Yaqub bəy Kəmaxı tərk edib Cahangir mirzənin yanına – Amidə getmişdi və orada haqqa qovuşmuşdu (vəfat etmişdi). Onun Cəlal adlı nökəri Kəmaxın daruğası idi. O, hiylə ilə Şeyx Həsən bəyi qalaya gətirib həbs etdi və Ərzincan boş qaldı.

### Diyarbəkr bölgəsində baş vermiş hadisələr haqqında

Əli Məmaş, Sultan Həmzə zamanında ucalmışdı. O, insanların ən rəzillərindən olduğu üçün Ağqoyunlu əmirləri ilə yaxşı keçinmirdi. Onları uzun bir müddət idi ki, incik salmışdı və təbəələr ona nifrət edirdilər. Cahangir mirzənin hüzuruna gəldiyi vaxtdan həmişə xoflu idi. Ona görə də ondan uzaqlaşıb yenidən Birəcükə qayıtdı və qardaşı İbrahimlə ittifaq bağladı. Onlar Birəcükü zəbt etdilər.

Fəxrəddin o qalanın əvvəlki hakimi idi və onlar qalanı onun ixtiyar əlindən çəkib almışdılar. O, Əli Məmaşın olduğu qalanı Cahangir mirzənin adından mühasirəyə aldı. Əli Məmaş Bağdada adam göndərib Osman bəyin oğlu Mahmud bəydən Bağdaddan Birəcükə yollanmasını xahiş etdi və qalanı ona təslim edəcəyinə söz verdi. Mahmud bəy Bağdaddan gəlib Fəxrəddini məğlubiyyətə uğratdı. [Əli Məmaş] qalanı ona təslim etdi. Ərzincan da boş qaldığından və Şeyx Həsən bəy hiylə ilə həbsə alınıb dustaq olduğundan Şeyx Həsən bəyin[743] nökərlərini Ərzincandan göndərdilər və Mahmud bəyi dəvət etdilər. Mahmud bəy Birəcükü Əli Məmaşın qardaşı İbrahimə tapşırdı və özü Ərzincana gəldi.

Bu arada Cahangir mirzə Ərzincanı mühasirə etmək üçün qoşun çəkdi. Qırx gün qalanın qapısı ağzında döyüşdülər. İlk döyüşdə Həsən bəy hərb əzmi ilə üzəngiyə ayaq qoydu. Dövranın bahadırlarından və adlı-sanlı aslan ərlərdən Bayəzid bəy onun qabağında gedirdi. Döyüş başlamaq üzrə ikən Bayəzid bəy şəhər

---

[742] Nuruosmaniyyə nüsxəsində Hüseyn əvəzinə Veys yazılmışdır.
[743] Mətnin bu yerində “Şeyx Həsən paşa” yazılmışdır *(Həsən bəy Rumlu. Əhsənüt-təvarix, 1389-cu il nəşri, I c., s.390).*

əhlinin ox yağışından qorxaraq yüyənini dartsa da, Həsən bəy bundan heç çəkinmədi və geri dönmədi. Şəhər əhli bir anda əllərini açıb kaman yuvasından oxların havanı bürüyən quşlarını uçurdular. Bir ox onun üzünə gəldi və böyük bir yara açdı. Onun bədəninə nizədən və oxdan təqribən iyirmi yara dəydi. Onun əzalarına oxların batmasına baxmayaraq, o, bu halda qol-qanad açıb quş kimi zalım düşmənin üzərinə şığıyırdı. Şəhər əsgərləri onun savaş pəncəsinin qorxusundan xəndəyə tökülürdülər. Bu döyüşdə möhürdarın[744] atının sinəsinə bir nizə dəydi ki, həmin nizənin ucu atın çiyninə yetişdi. İkinci döyüşdə Cahangir mirzənin nökərləri yubanmadan döyüşə atıdılar və vuruşmaq üçün şəhərdən çıxmış piyadaların üzərinə atlarını çapdılar. Amma davada üstünlük qazana bilmədilər. Həsən bəyin qeyrəti hərəkətə gəldi. O, atını düşmənlərin üzərinə çapdı və şəhər əsgərlərini bir həmlədə xəndəyə tökdü. Bu döyüşdə Qarabulut [adlı] ata minmişdi. Xəndəkdən bu atın sinəsinə bir nizə atdılar. Buna görə Həsən bəy geri çəkildi. Ərzincanlılar anidən yenə şəhərdən çıxdılar. Həsən bəy ata mindi. Xızır bəy, Fulad bəy və Bikmiş Novruz at çapdılar. Həsən bəy şəhərliləri xəndəyə tökdü. Şeyx Həsən bəy Pornakla Bayəzid bəy Pornak digər bir tərəfdən böyük bir döyüş etdilər. Şəhərlilər yenə qalib gəldilər. Şeyx Həsən Kürdün oğlunu atdan saldılar. Qartal (Həsən bəy) geri qayıdıb onu xilas etdi. Qırx gündən sonra Cahangir mirzə Oxuya[745] getmək üçün Amidə yollandı.

### Müxtəlif əhvalatlar

Bu il Sultan Murad padşah, Məzid bəyi çoxlu ordu ilə kafirlər diyarına basqın etməyə yolladı. Onlar Əflaq diyarından keçib Engirüs vilayətini qarət etdilər. Kral çoxlu ordu ilə onlarla döyüşməyə gəldi. Xeyli döyüşdən və vuruşdan sonra Rum qoşunu məğlub olub Ədirnəyə geri qayıtdı.

Bu il Cahanşah padşah nadir Təbriz şəhərində olan bir dəstə hürufini mübahisədən (müzakirədən) sonra qətlə yetirdi.

## 846-CI İLİN (12.05.1442 – 30.04.1443) HADİSƏLƏRİ

Bu il Məlik Kəyumərs Rüstəmdari başını itaət boyunduruğundan çıxardı və fəsadçılardan, şeytana tabe olub onun əşyasına çevrilənlərdən, donuz və ayı kimi adamyeyənlərdən, köpək və pişik kimi etibarsızlardan [ibarət],

Şeir

“Ov iti kimi cuman, ayı kimi qarınqulu,
Canavar kimi yırtıcı, köpəklər kimi qapan.
Nakişi kimi utanmaz, sərxoş kimi sonunu düşünməz,
Uşaq kimi nəfsli, müsibət görmüş kimi səbirsiz.
Dağda pələnglə bir yerdə yatmış,
Çöldə qurdlarla bir hövzədən su içmiş”

bir dəstəni Rey və Dəmavəndə basqın etməyə göndərdi. O diyarda fitnə-fəsad tozu yüksəldi. Bu xəbər alinəsəb padşahın qulağına çatdıqda bəla əlamətli bir ordu ilə o bədbəxtin üzərinə yollandı. Qalib məiyyət Nişapur vilayətindən keçdikdə Məlik Kəyumərsi böyük bir xof bürüdü və o, ərşə bənzər dərgaha bir ərizə göndərib xəbər verdi: “Mənim nə həddim var ki, qalib qoşunun bir dəstəsinin belə qabağında dayana bilim?! Əgər məqsədiniz vilayəti ələ keçirməkdirsə, kimə tapşırsanız, ona təslim edərəm”.

Beyt

“Əgər sənin ehtişamın zəmanəyə hayqırarsa,
Günlərin həftəsinin qatarı yüyənini itirər”.

Ona görə də o həzrət onun günahından keçib Herat tərəfə qayıtdı və Sultaniyyə, Qəzvin, Rey və Qum vilayətlərinin idarəçiliyini Mirzə Sultan Məhəmməd Baysunqura lütf etdi.

---

[744] Möhürdar (möhrdari-möhri-hümayun) – şahın möhürünü saxlayan şəxs. Səfəvilərin erkən dövrlərində möhürdar vəzifəsini tutan şəxs böyük hörmətə malik idi. O, vəzifə təyinatları ilə bağlı fərmanlara və müxtəlif sənədlərə şahın möhürünü vururdu (daha ətraflı bax: *О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.264-265*).

[745] Diyarbəkr yaxınlığında yaylaq adıdır *(Nəvai, şərhlər, 391).*

### Müxtəlif əhvalatlar

Bu il Rum padşahı Sultan Murad Sofiya diyarına gedib Şihabəddin paşanı qoşunla kafirlər ölkəsinə basqın etməyə göndərdi. Onlar Əflaqdan keçib Engirüs diyarını talan etdilər. Bu əsnada yeniçərilər və sipahilər qənimət ələ keçirmək üçün pərən-pərən olmuşdular. Məlun Yanko[746], Xadim bəylə Məzid bəyin üzərinə hücum edib Rum ordusundan bir çoxlarını qətlə yetirdi.

## 847-Cİ İLDƏ (01.05.1443 – 19.04.1444) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Mirzə İsfahanın ölümü və Cahanşah padşahın Bağdadı ələ keçirməsi

Bu ilin əvvəllərində Qara Yusif Türkmanın oğlu İsfahan bəy hərəkət bayrağını axirət aləminə yüksəltdi. Onun Kor Məzid bəy, Şiblulla, Rüstəm Tərxan, Çağırıçıoğlu, Məhvək Ağqoyunlu və Hüseyn Əmiraxur kimi əmirləri İsfahan mirzənin oğlunu səltənətə əyləşdirdilər. Bu xəbər ali məqamlı hökmdar Mirzə Müzəffərəddin Cahanşaha çatdıqda Azərbaycandan çoxlu ordu ilə Bağdad tərəfə hərəkətə gəldi.

Beyt

“Bağdadı dağıtmağa niyyət etdi,
Cahanı bağdadlılara dar etdi.
Elə çapdı külək ayaqlı dəvəni ki,
Səba küləyi ondan yüz mil arxada qaldı”.

O zaman Rüstəm Tərxan, İsfahan mirzənin oğlundan üz döndərib müzəffər orduya qoşuldu. Cahanşah padşah, qardaşı oğlu Əlvənd İsgəndər oğlu, Əmir Bayəzid Bistam, Sarı Pirəli və Nasirəddinin qardaşı Nurəddin hədsiz bir ordu və çoxsaylı qoşunlarla Bağdadın şərqində dayandılar.

Nəzm

“Ordu bu başdan o başa qədər,
Əhatəyə aldı Bağdadı.
Savaşdan qorxan əcaib bir qala vardı,
O, timsahın halqasında gizlənmişdi.
O qalanın ətrafındakı hər bir xəndək,
Qayığın quyruğundan yapışmış timsaha bənzəyirdi.
Orada dəmir bir qala var idi,
Yerdən göyün onuncu qatına yüksəlmişdi.
Onun hündürlüyü həddən-hüduddan artıq idi,
Doqquz göydən bir sidr[747] qədər yüksək idi.
Ucalıqdan yüksək asiman olmuş,
Fələklər də onun bürcləri olmuş”.

Bərə körpünün üstündə böyük bir vuruşma baş verdi. Gəmiçilər körpünü şəhərə tərəf apardılar. Sarı Pirəli və Nurəddin kin meydanının bir dəstə bahadırı ilə suda qərq oldular. Məhvək Ağqoyunlu və Ömərşeyx, Rüstəmlə ittifaq edib şəhəri Cahanşah padşaha təslim etdilər. Cahan padşahı sipahilərin qətlinə fərman verdi. Çağırıçıoğlu və Məhəmməd Şiblulla gəmiyə minib şəhərin bir fərsəxliyində dayandılar və gecə gəmidən çıxıb özlərini Cahanşah padşahın evinə (qaldığı evə) saldılar. Kor Məzid o izdihamdan özünü Əmir Bayəzid Bistamın evinin qapısına yetirdi.

Ertəsi gün Cahanşah padşah Ağcaqapıdan şəhərə daxil olub imkanı yetdiyi qədər Bağdad sipahilərinə zülm və əziyyət etdi. Göz yaşından Dəclə çayları axdı və əmin-amanlıq gəmiləri zülm və düşmənlik dənizində batdı.

Qoşunun içində olan Mirzə İsfahanın oğlu mükəmməl qabiliyyətli, son dərəcə mərd və mürüvvətli bir cavan idi. O, gecə böyük bir hərb etdi. Hər an onun iti qılıncının parıltısından səmada bir komet görünür

[746] Macar sərkərdəsi Yanoş Hunyadi.
[747] Sidrə (sidr) – şam fəsiləsindən olan hündür və həmişəyaşıl iynəyarpaqlı ağac cinsidir. Şərq ədəbiyyatında ucalıq, böyüklük rəmzi kimi qəbul olunur.

və hər həmlədə meydanda çapan atından torpaq göyə qalxırdı. Hərçənd ətrafdan və yan-yörədən piyada və atlılar ona hücum etsələr də, onu tuta bilmədilər. Səhər çağı padşahın mürüvvətinə etimad edib, Cahanşahın cahanın pənahı olan dərgahına üz tutdu və həmin döyüş yarağı ilə təntənəli bir şəkildə aman xələti alacağına ümidvar olaraq türkman hökmdarının önünə gəldi. Diz çöküb aman dilədi. Cahanşa padşah onun acizliyinə, çarəsizliyinə və aman diləməsinə məhəl qoymayaraq son dərəcə insafsızlıqla onu əsirlərdən ibarət bir camaatla birlikdə qətlə yetirdi. Dağılmağa üz tutmuş o şəhər abadlaşdırıldı və fitnə-fəsadın açılmış yolu bağlandı. Məmləkət ağacından qiyamçılıq və düşmənçilik budağı kəsildi. O həzrət Bağdad hakimliyini oğlu Məhəmmədi mirzəyə həvalə etdi. O oğlanın və islam əhlinin Darüssəlamının (Bağdadın) işlərinin həllinin yüyənini Gəbr Abdullanın qüdrət əlinə buraxdı. Mosul hökumətini isə öz qardaşı oğlu Əlvəndə, Rüstəm Tərxana, Məhmada və İsgəndərin övladlarına tapşırdı və yaylağa getmək üçün hərəkət bayrağını qaldırdı.

### Rum diyarında baş vermiş hadisələr və İbrahim Qaramanoğlunun Sultan Murada qarşı müxaliflik etməsi

Bu il İbrahim bəy Qaramanoğlu çoxlu qoşunlar toplayıb Anadolu vilayəti tərəfə hərəkətə gəldi və şəhərləri talamaqla, bəndələrə əziyyət verməklə məşğul oldu. Bu vəziyyət barədə xəbər Sultan Muradın qulağına çatdıqda öz oğlu Əlaəddini Rumeli ordusu ilə Qaramanoğlunu dəf etməyə göndərdi. İbrahim bəy ordunun gəlişindən xəbər tutduqda onun ürəyini tamamilə xof bürüdü və öz diyarına qayıtdı.

O zaman Sultan Əlaəddin xəstəlik yatağına böyrünü qoyub həyatını Əzrailə tapşırdı. Sultan Murad bu haldan agah olduqda bütün dövlət ərkanı ilə nalə və ah-zar etməyə başladı[748].

Beyt

“Mülk başçıları köynəklərini cırdılar,
Atların quyruğunu və yalını kəsdilər”.

Bu əsnada xəbər çatdı ki, Engirüs padşahı Yanko və Sivek (?)[749], Las vilayətinin valisi[750] ilə ittifaqda Sofiya diyarına daxil oldular. Oranı yandırıb Qasım paşanı və Turxan bəyi məğlub etdilər.

Sultan Murad bə xəbəri eşitdikdən sonra bəla əlamətli bir ordu ilə o bədbəxt qövmün üzərinə yola düşdü və qışın ortasında İzlat keçidində[751] bədnihad Yankoya çatdı. Onlar qılınc və nizə işlətmədən qaçmağa başladılar. Sultan Murad, Balaban paşanı və Turxan bəyi beş sancaq[752] əmiri ilə onların ardınca göndərdi. Əmirlər kafirlər ordusunun ardından çatdılar. Balaban paşa yüyənini çəkib dövlət ərkanı ilə məşvərət etdi. Döyüşməyə qərar verdilər. Kafirlər də onların müqabilində ordu səfi bağladılar. Hər iki qoşun Əxzər dənizi kimi coşmağa və gurlamağa başladı. Firəng ordusu Rumeli ordusunun sərdarı olan Turxan bəyə həmlə etdi və Rumeli ordusu buna tab gətirməyib qaçmağa üz qoydu.

Beyt

“Ox dəymiş qaban kimi həmlə edir,
İgidə aradan çıxmaq fərz olur”.

Anadolu ordusu da kafirlərin həmləsinə tab gətirməyib fərar yolunu tutdu. Xəlil paşanın[753] qardaşı Mahmud Çələbi bir dəstə bahadırla birlikdə əsir tutuldu. Bu döyüşdən sonra sultan Ədirnəyə yollandı və Lasoğlu (Serb hökmdarı) ilə sülh bağlayıb onun şəhərlərini geri verdi.

Bu əsnada İbrahim bəy Qaramanoğlu fürsəti qənmət bilib, Anadolu vilayətini qarət edərək istila bayrağını yüksəltdi. Ona görə də Sultan Murad çoxlu ordu ilə Qaraman vilayəti tərəfə hərəkət etdi. Qaramanoğlu müxaliflikdən peşman olub, sülh və asayiş istəyərək üləmanın ən fəzilətlisi və fazillərin ən kamili olan Sarı Yaqubu Sultan Muradın yanına göndərdi. Mövləvi cənabları (Sarı Yaqub) uzlaşma və anlaşma əlinini sülh

---

[748] Sultan Əlaəddin, Osmanlı sultanı II Muradın oğlu idi. Ə.Nəvainin yazdığına görə, Amasya hakimi olan Əlaəddin əslində öz atasının əmri ilə Qara Xızır adlı bir şəxs tərəfindən öldürülmüşdür *(Nəvai, şərhlər, s.397-398).*

[749] Nuruosmaniyyə nüsxəsi: “Sinok”. Ola bilsin ki, bu ad altında Polşa kralı III Vladislav nəzərdə tutulur *(Nəvai, şərhlər, s.398-399).*

[750] Serbiya hakimi Yorge Brankoviç nəzərdə tutulur *(Nəvai, şərhlər, s.397).*

[751] İzlat keçidi – Orta Bolqarıstanda yerləşir.

[752] Sancaq – türkcə “sancmaq” felindən yaranıb və əvvəllər bayraq mənasında işlədilib. Osmanlı dövlətində “sancaq” həm də inzibati ərazi vahidini bildirirdi və bu ərazi vahidinin başında “sancaqbəyi” adlanan məmur dururdu.

[753] Osmanlı sədrəzəmi Çandarlı Xəlil paşa.

yaxasına uzadıb, araqarışdıranların fəsadı nəticəsində dostluğun çöhrəsinə qonmuş tozu sülh və asayiş suyu ilə yudu. Ona görə də Sultan Murad yeniçəri və əzəblərə izin verib Manisaya gəldi və həmin şəhərdə qışlaq etdi.

Həmçinin bu il Şahrux padşah, Şəmsəddin Məhəmməd Əbhərini Misir tərəfə göndərdi və Sultan Çakmakdan xahiş etdi ki, Kəbə evinə örtük geydirməsinə icazə versin. Sultan Çakmak qəbul etdi.

## 848-Cİ İLDƏ (20.04.1444 – 08.04.1445) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Sultan Muradın Firəng sultanı ilə müharibə etməsi

Bu il Firəng sultanlarının böyüklərindən olan Kral və Yanko bir-birinə elçilər yolladılar və məktublar göndərdilər[754]. Məzmunu belə idi ki, "gərək hazırlıq görüb savaşa başlayaq və qantökən qılınc zərbəsi ilə Sultan Muradın əzalarını tikə-tikə edək". İki tərəfdən ardıcıl və davamlı olaraq elçilər və məktublar göndərildi və aralıqda əhd-peyman bağlandı. O iki pis etiqadlı öz məkanlarından və qərargahlarından çıxıb yol mənzillərini qət etdikdən sonra bir-biri ilə birləşdilər və səksən min nəfərlik izdihamlı və nizədar süvaridən ibarət Alman, Engirüs, Latın, Bosna, Polona (Polşa), Əflaq və Firəng ordusu toplandı. Onların çoxlu topları və tüfəngləri vardı və böyük bir heybətlə yola düşdülər.

Şeir

"Elə bir ordu ki, heybətdə dənizin ləpələri kimi,
Elə bir güruh ki, çoxluqda ulduzların sayı qədər.
Forma və məzmun bir-birindən ayrılmadığı kimi,
Onlar da ayrılmazlar öz ömürlərində savaş səfindən".

Beluzğatdan (Belqraddan?) keçib, Madra və Şumlu vilayətini[755] qarət edərək Bolunu[756] mühasirəyə aldılar. Lakin o qövmə məlum oldu ki, o qalanı tutmaq mümkün deyildir. Köç edib Ədirnəyə yollandılar. Nigbolu[757] ətrafında Firuz bəyin oğlu Məhəmməd bəy onların ardınca gəlib onların bir dəstəsini qətlə yetirdi və başlarını Sultan Muradın dərgahına göndərdi. Sultan Murad dənizdən keçib onların yolunu kəsmək istədi. Lakin firənglər keçidi tutduqları üçün özünə tabe olan Firəng gəmisinə minib Qalatadan keçdi və Rumeli diyarına daxil oldu. Ətrafa elçilər göndərib qoşun topladı və Sultan Məhəmmədi[758] savaşa göndərmək istədi. Axırda ərz etdilər ki, "dövlət üçün xeyirli olan Sizin özünüzün yürüşə getməyinizdir". Ona görə də Sultan Murad qaraltısı cahanın enişini və yoxuşunu bürümüş, uzunu və eni qurunun və dənizin hüdudunu aşmış hədsiz-hesabsız bir ordu ilə kafirlərin qarşısında səf çəkdi. Döyüş meydanının səthi çövşən və zirehlərdən dəmirə döndü. Savaş məkanının havası qılıncın şimşəyindən və xəncərin ildırımından atəşə döndü. Sanki kin buludundan yağış yerinə tüfəng yağırdı və savaş məkanının torpağından bitki yerinə mizraq bitirdi.

Nəzm

"Yer üzü göy rənginə döndü silahdan,
Göy üzü yer rənginə döndü tozdan.
Azğınların ürəkləri qarışqa gözü kimi oldu,
Ox ucları ilanın dişləri kimi oldu".

Atların tozanağından işıqlı gündüz qaranlıq gecəyə döndü və günəşin parlaq çeşməsi tozun zülmətində gizləndi.

Beyt

"Döyüş meydanındakı minik heyvanlarının nallarından,
Təzə ay gizləndi tozun altında.
İki dəmir dənizi savaşa girdi,
Orada yüz minlərlə timsah görünürdü".

---

[754] Yanoş Hunyadi (Yanko) – Polşa və Macarıstan kralı III Vladislavın Transilvaniyadakı valisi idi.

[755] Madra – Bolqarıstanın Qara dəniz sahilində yerləşən və vilayət mərkəzi olan Varna şəhəri. Şumlu (Şumnu) – Varnadan qərbdə yerləşən və vilayət mərkəzi olan bir şəhərdir.

[756] Bolqarıstanın Yambol şəhəri nəzərdə tutulur.

[757] Nigbolu (Niğbolu) – Bolqarıstanın şimalında, Dunay çayı sahilindəki Nikopol şəhəri.

[758] Sultan Məhəmməd (Fateh Sultan II Mehmed) – Sultan Muradın oğlu idi.

Əvvəlcə lənətəgəlmiş Yanko kin meydanının bahadırlarından [ibarət] bir dəstə ilə Anadolu ordusuna həmlə edib qantökən qılıncın zərbəsi və fitnəsalan nizənin ucu ilə Qaraca paşanı Anadolu ordusunun bir dəstəsi ilə birlikdə yerə sərdi.

Şeir

"Baş və bədən bir-birindən ayrıldı qılıncla,
O meydanda düşdü başlar amansızca.
Hava almaz rəngli şimşəklərlə doldu,
Bu, elə bir şimşək idi ki, onun yağışı qan idi".

Anadolu ordusu belə bir döyüşə tab gətirməyib qaçış yolunu tutdu. Rumeli qoşunları da vuruşmanı tərk edib fərar vadisinə tələsdilər. Kral öz cəsarəti, qorxmazlığı, çevikliyi və cəldliyi üzündən tənha şəkildə Sultan Muradın [ordusunun] mərkəzinə at çapdı. Atı aşdıqda o da yəhərin üstündən yerə yıxıldı. Qoca Xızır adlı yeniçəri onun başını bədənindən ayırıb Sultan Muradın yanına gətirdi və onun başını nizəyə taxıb "Allah-Allah" fəryadını günəşə və aya çatdırdılar.

Bu möhnətli xəbər bədbəxt Yankoya çatdıqda kafirlər ordusuna dedi ki, "biz bu döyüşə Kral üçün gəlməmişdik, əslində, din uğurunda bu böyük işə girişmişdik". Onlar daha üç dəfə həmlə edib Rum ordusunu yerindən dəbərtdilər. Rum ordusu da həmlə etdi. Düşmənlər onların hücumuna tab gətirməyib bəziləri öz canlarının qorxusundan arabalara sığındılar, digər qismi isə aləmin yan-yörəsinə və ətrafına səpələndilər. Rum süvariləri firənglərin arxasınca at çapıb onları kin qılıncı ilə vurdular. O gün səhərdən axşamacan Əzrail öz işi ilə məşğul oldu.

Şeir

"O təlaş və savaş meydanında,
Əcəl can almaqdan təngə gəldi.
Əcəlin mərdlərdən savayı təmənnası yox idi,
Çünki o, yerə-göyə sığmırdı".

Yeniçəri və əzəblərin hamısı arabaları qəzəblə dövrəyə aldılar. Çoxlu döyüşdən sonra onları da qətlə yetirib firəng igidləri üçün işıqlı gündüzü qaranlıq gecəyə çevirdilər. Onların cəsədləri üzündən çöl təpə və dağla bərabər səviyyəyə çatdı.

Beyt

"Çərxi-fələyin altında peyda oldu ruhlar aləmi,
O, çox sayda öldürülmüş canlardan yaranmışdı".

Kafirlər qoşununun mallarını və əşyalarını ələ keçirdilər. Sultan Murad yüksək rütbəli paşalarla üç gün orada qalıb daha sonra Ədirnə tərəfə qayıtdı.

## Müxtəlif əhvalatlar

Həmçinin bu il Şahrux padşah, Şeyx Nurəddin Məhəmməd Mürşidini və Mövlana Şəmsəddin Məhəmməd Əbhərini Həccə göndərdi ki, Kəbə evinə örtük geydirsinlər. Onlar Misirə çatdıqları vaxt o diyarın əhalisi onları qarşılamağa tələsib onları münasib bir məkanda yerləşdirdilər. Üçüncü gün Sultan Çakmağın hüzuruna getdilər. Sultan onları yaxşı qarşılayıb çoxlu flori bağışladı. Misir və Şam əmirlərinin Əmir Teymur Kürəkanın xanədanına sevgisi olmadığı üçün sultanın elçilərə böyük ehtiram göstərməsi o diyarın rəislərinin könlünə çox ağır gəldi. Bir gün sultan onları çağırdı. Onların məclisdə oturmaqları uzun çəkdiyindən sultanın onları həbs etdiyinə dair şayiələr çıxdı. Avam camaat onların evinə soxulub, Məkkə örtüyündən savayı, onların evində olan hər şeyi apardı.

Sultan bu xəbəri eşitdikdə buyurdu ki, "fitnəkarlar mənim dostlarımı incitmişlər" və elçilərdən xeyli üzrxahlıq etdi. Böyük andlar içdi ki, "bu hadisədən xəbərim olmamışdır" və onları çoxlu mallar və əşyalarla təmin edib Həccə yola saldı. Onlar Kəbənin örtüyünü geydirib Herata qayıtdılar. O əsnada elçilərlə birlikdə getmiş Əbdülməlik adlı birisi Şahrux padşaha ərz etdi ki, "Şeyx və Mövlana Misir sultanının verdiyi ənamları bizə çatdırmamışlar". Əmirlər sorğu-sual aparıb onların payını özlərinə verdilər.

Həmçinin bu il Şahrux padşahın zatını şiddətli bir xəstəlik bürüdü. Bir müddət sonra xəstəlik sağalmağa üz tutdu.

Həmçinin bu il Şahrux padşahın əmirülüməraşı Əmir Cəlaləddin Firuzşah Tərxan vəfat etdi. Adı çəkilən əmir çox xeyirxah və ədalətli idi və elm əhlini himayə etmək istiqamətində çoxlu səy göstərmişdi.

Həmçinin bu il Şahrux padşahın oğlu Əmir Məhəmməd Cuki, Gövhərşad bəyimin iltifatsızlığı ucbatından olduqca qəm-qüssə içində yaşadığı bir vaxtda Sərəxs nahiyəsində vəfat etdi. Onun cəsədini Herata gətirib Mirzə Baysunqurun yanında dəfn etdilər.

## 849-CU İLDƏ (09.04.1445 – 28.03.1446) BAŞ VERMİŞ HADİSƏLƏR

### Baysunqurun oğlu Mirzə Məhəmmədlə Hacı Hüseyn Həmədani arasında müharibə

Mirzə Sultan Məhəmməd İraqda yerləşdikdən sonra çoxlu qoşunlarla İsfahana yollandı. Şahrux padşahın tərəfindən o diyarın valisi olan Əmir Xavəndşahın oğlu Səadət bəy fərar etdi. Mirzə Sultan Məhəmməd bir dəstə bahadırı onun arxasınca göndərdi. Onlar onu tutub dərgaha gətirdilər. Mirzə Sultan Məhəmməd onu qəfəsə salıb, onun xeyirverməz dostu olan Seyid Əlini qətlə yetirdi. Ali mənşəli şahzadə şəhər qalasında məclis qurub şəhərin və vilayətin böyüklərinə üç min xələt bağışladı. Bəzisi on iki dinarlıq, bəzisi isə iyirmi dörd dinarlıq olan on min təngəni və min florini Təxti-Qaraca meydanında şabaş etdi. O məclisdə Cahanşah padşahın elçiləri iştirak edirdilər. [Mirzə Sultan Məhəmməd] İsfahan nəqibi[759] Şah Əlaəddinə dövlət işlərində böyük səlahiyyət verdi və Xoca İmadəddin Mahmud Heydər Üştürcani ilə Əmir Əhməd Çupanı vəzir təyin etdi. O diyarın bütün hakimləri ali mənşəli şahzadənin dərgahına gəlsələr də, təkcə Əmir Hacı Hüseyn Həmədani cəhalət və nadanlıq üzündən təmkin və vüqar ayağını öz ətəklərinə çəkdi və şahzadənin yanına heç kimi göndərmədi. Ona görə də Mirzə Sultan Məhəmməd sayı ulduzlar qədər olan ordu ilə Həmədana yönəldi. Əmir Hacı Hüseyn fitnə-fəsad əhli olan bir dəstə ilə onun qarşısına gəldi. Döyüşdən və vuruşdan sonra qələbə yeli yaxşı əməl sahibi olan şahzadənin bayrağının pərçiminə doğru əsdi. Əmir Hacı Hüseyn qaçış yolunu tutub, həmdəmlərindən üç nəfərlə birlikdə Həmədan qalasının qapısına gəldi. Onlar (qala camatı) onun xahişini rədd etdilər. Axırda o, Əlvənd dağında[760] səadətli şahzadənin mülazimlərinin əlinə düşdü. Mirzə Sultan Məhəmməd onu əmisi oğluna tapşırdı. O da öz atasının qisası naminə onu qətlə yetirdi.

Bu xəbər Şahrux padşaha çatdqda onun mübarək könlünə çox ağır gəldi. Mirzə Sultan Məhəmməd Həmədanı ələ keçirdikdən sonra dinar və dirhəm xərcləmək üçün əlini açdı. Onun mədaxili məxaricini ödəyə bilmədi. O əsnada İraqda Şahrux padşahın xəstəliyi [xəbəri] yayıldı. Bəzi fitnəkar adamlar şahzadəyə belə ərz etdilər:

- Yaşının çoxluğu Şahrux padşahı əldən salmış və o, ağıl zinətindən məhrum qalmış, yaxşını pisdən ayıra bilməyəcək bir vəziyyətə düşmüşdür. Bu fürsəti qənimət bilmək gərəkdir. Siz indi Şiraz və İsfahan şəhərlərini öz hakimiyyətiniz altına almalısınız.

Ona görə də Sultan Məhəmməd İsfahana basqın edib oranın valisi Əmir Səadət Xavəndşah oğlunu tutdu. O vilayəti zəbt etdikdən və hədsiz dərəcədə mallar ələ keçirdikdən sonra hərəkət bayrağını Şiraza doğru yüksəltdi.

Mirzə Sultan Abdulla o ali mənşəli şahzadənin gəlişindən agah olduqda şəhərə sığınaraq, şimək və külək kimi [sürətli] bir qasidi Herata göndərdi və əhvalatı ərz etdi. Mirzə Məhəmməd Şirazı bir mərkəz kimi əhatəyə aldı.

### Müxtəlif əhvalatlar

Bu il Rum padşahı Sultan Murad səltənəti tərk edib Manisada məskunlaşdı və oğlu Sultan Məhəmməd səltənətə əyləşdi.

---

[759] Nəqib – məna etibarilə hansısa bir icmanın rəhbəri və ya vəkili deməkdir. Səfəvi zamanında şəhər idarəçiliyində nəqib vəzifəsi vardı. Nəqiblər şəhər əsnaflarının mənəvi və inzibati başçısı idilər və kələntərlərin köməkçiləri və müavinləri hesab olunurdular. Onlar şəhərin adlı-sanlı şəxsləri arasından təyin edilirdilər. Nəqiblərin başçısı "nəqibül-nüqəba" (nəqiblər nəqibi) adlanırdı (daha ətraflı bax: *М.Х.Гейдаров. Социально-экономические отношения, с.36, 65, 72,82-83,113; V.F.Minorsky. «Tadhkirat al-Muluk», p.148-149*). Osmanlılarda isə seyid və şəriflərlə əlaqədar məsələlərə baxan məsul şəxs "nəqibül-əşraf" adlanırdı *(Ş.T.Buzpınar. Nakîbüleşrâf // TDVİA, cilt: 32, yıl: 2006, s.322-324).*

[760] Əlvənd dağı – Həmədan şəhəri yaxınlığındadır və hündürlüyü dəniz səviyyəsindən 3500 m. yüksəkliyə çatır.

## 850-Cİ İLDƏ (29.03.1446 – 18.03.1447) BAŞ VERMİŞ HADİSƏLƏR

### Şahrux padşahın Şiraz tərəfə qoşun çəkməsi və Mirzə Sultan Məhəmmədin fərar etməsi

Mirzə Sultan Məhəmmədin müxalifliyinin xəbəri Şahrux padşahın qulağına çatdıqda, qocalıq əlamətlərinin özünü göstərməsinə baxmayaraq, şərəfini qorumaq üzündən və iffətin pənahı olan Gövhərşad bəyimin təkidi ucbatından hərəkət bayrağını Fars tərəfə qaldırdı və Mirzə Əlaüddövləni isə Heratda öz yerinə qaimməqam qoyub yola çıxdı. [Dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin padşahı Nişapura çatdıqda, Cahanşah Türkmanın elçisi Azərbaycandan zəfər nişanlı orduya gəlib, gətirdiyi peşkəşləri təqdim etdi və Cahanşahın [aşağıdakı məzmunda] ərizəsini ərz etdi:

- Mən yalqız bir cavan süvari idim. Bu gün isə qüdrətli dövlətin sayəsində yüz min süvariyə sahibəm və özümü Cəmşid məqamlı dərgahın mülazimlərindən və xidmətkarlarından sayıram. Ümidvaram ki, əvvəlki qaydada lütfkarlıq və qayğıkeşlik gözünü üzərimdən çəkməyəcəksiniz.

O həzrət elçiyə böyük hörmət göstərib ona geri dönmək üçün icazə verdi. Mövlana Cəmalülislam Simnanini Gilana göndərdi. Çünki Mirzə Sultan Məhəmmədin fərmanı ilə Əhməd Moğol Sultaniyyə qalasını tutmağa getdiyi zaman Lahican[761] padşahı Əmir Nasir Kiya Gilan qoşunlarının bir dəstəsini onu dəf etməyə göndərmişdi və bu xidmət hökmdarın (Şahruxun) xoşuna gəlmişdi.

Qələbə ayəli bayraqlar gəliş kölgəsini o diyarın üzərinə saldıqdan sonra [Şahrux padşah] Əmir Müzəffərəddin Sultanşah Barlası, Əleykə Kükəltaşın oğlu Əmir Qiyasəddin Şeyx Əbülfəzli və Firuzşah Tərxanın oğlu Əmir Nizaməddini mənqəlay [təyin] etdi. Qələbə bayraqlarının şahbazı Şirazı ələ keçirmək üçün pərvaza gəldi. Mirzə Sultan Məhəmməd uca səviyyəli hökmdarın gəlişindən agah olduqda, padşahlıq ləvazimatlarından ürəyini çəkib, Şiraz ətrafından köç edərək öz ordugahını dağıtdı, öz çadırına od vurdu və kölələrindən, xidmətçilərindən və üzü örtülü hərəmlərindən [ibarət] az adamla Luristana tələsdi.

Beyt

“Aslan yıxan igidlərin nərəsindən,
Qaçdı meşədən o qızğın aslan”.

Luristanda bu qəzəli deyib Şahrux padşaha göndərdi:

Nəzm

“Mən zərrə kimi üzümü gönəşdən gizlətmişəm,
Bunu dövranın cəfası və qardaşlarımın cövründən etmişəm.
Mən sultanın hörmətini saxladım, onunla savaşa çıxmadım,
Öz nökərlərimi hər tərəfə pərən-pərən etdim.
Mən Hacı Hüseynlə Həmədan uğrunda elə savaşdım ki,
Dastandakı Rüstəm heç Əfrasiyabla elə savaşmamışdı.
İraqda sultanın uğrunda həmişə qılınc vururam,
Öz sinəmi Xorasan üçün sipər etmişəm.
İraqda nökərimi imtahan etmək istədim,
Şah elə başa düşdü ki, mənim qəsdim İsfahandır.
Mənə qəsd etdi o Cahanşah və gəldi qoşunu,
Mən pusqudan çıxıb onun qoşununu yerlə yeksan etdim.
Digərlərinin eyş-işrətə həvəsi var, mənim isə arzum döyüş meydanıdır,
Mən onlar kimi deyil, mərdliklə yaşamışam.
Mən Sultan Baysunqur xanın oğluyam,
Döyüşdə daima külək ayaqlı atımla cövlan etmişəm.
Mənim adım Məhəmməddir, Əhmədin dini üçün,
Mən öz canımı Şahi-Mərdana[762] fəda etmişəm”.

---

[761] Lahican – İranın Gilan vilayətində şəhər. O zamanlar Lahican paytaxt olmaqla Biye-piş əmirliyi vardı.

[762] Şahi-Mərdan (farsca “kişilərin şahı” deməkdir) – Həzrət Əlinin ləqəblərindən biridir. Əhməd adı ilə Məhəmməd peyğəmbərə işarə edilmişdir.

O həzrət Mirzə Sultan Məhəmmədin fərarı xəbərini eşitdikdə İsfahan tərəfə döndü. İsfahanın böyüklərindən və seyidlərindən kübar seyid Şah Əlaəddini, Qazı Əminəddini[763] və Xoca Əfzəl Tərkəni Mirzə Sultan Məhəmmədlə ittifaq etdikləri üçün qətlə yetirdi. Nəql olunduğuna görə, Xoca Əfzələddin Tərkənin kəndiri iki dəfə qırıldı. O, fəryad etdi:

- Şahruxa deyin ki, bu cəza mənim üçün bir andan artıq deyildir; amma sən özünün əlli illik ad-sanını zay etmə!

Beyt

“Əlli ildə qazandığın yetərincə yaxşı ad-sanını,
Yox edərsən, pis bir işdə ad çıxarsan”.

Böyüklər hərçənd səy göstərsələr də, faydası olmadı. Amma Mövlana Şərəfəddin Əli Yəzdini[764] Mirzə Əbdüllətif xilas etdi. Şahrux padşahın qulağına çatmışdı ki, Mövlana, Mirzə Sultan Məhəmmədin hüzurunda bu beyti oxumuşdur:

Beyt

“Çərxi-fələk qocadır və sənin bəxt ulduzun cavandır,
Yaxşı olar ki, qoca öz növbəsini cavana versin”.

Xoca Pirəhməd Çupanı da onlarla birlikdə Savə darvazasından asdılar. Xoca Mahmud Heydər, Şah Qivaməddin Nəqib, Şah Nizaməddin Gülüstanə və Səfəviyyə sahibləri[765] dustaq edildilər. Amma xəbərləri yox idi ki, ümmətin ən şərəfliləri olan seyidlərin və alimlərin qətli möhkəm dövlətin süqutuna bais olacaqdır.

Nəzm

“Mürtəzanı[766] İsfahanda bir qoca,
Gördü yuxuda qızğın bir şir kimi.
Sürətli və həyəcanlı gəlmiş Nəcəfdən[767],
Savəyə yönəlmiş, əlində bıçaq.
Dedim: Ey həqiqi övliyalar şahı,
Haqqın aslanı, dünya və dinin bələdçisi!
Niyə qəzəb alovun alışmışdır?
Haraya gedirsən və səbəb nədir?
Allahın aslanı dedi ki, ey soruşan,
Tez gedirəm qatilin arxasınca.
Mənim günahsız övladımı öldürdü,
Qürur, cövr və cəfa üzündən Şahrux.
Səhər açılınca qoca bu yuxunu,
Gördüyü hər kəsə şərh edib dedi.
Qeyd etdilər bu hədisi ondan,
Gözlədilər ki, nə xəbər gələcək Reydən”.

O həzrət həmin qış Reyin Fəşapuyə [adlı yerində] qışlaq etdi. İstədi ki, Mövlana Əbdürrəzzaq Səmərqəndini Misirə göndərsin və səadətli yürüşünü xəbər versin. Buyurdu ki, farsca və türkcə məktub yazsınlar və məktubun üzərinə möhür vursunlar. Sultanşah Barlas, Şeyx Əbülfəzl Kükəltaş və Əhməd Firuzşah kimi bəzi böyük əmirləri Mirzə Sultan Məhəmmədin yanına göndərdi ki, şahzadəni ya zorla, ya da xoşluqla hökmdarın ordusuna gətirsinlər. Əmir Şeyx Əbülfəzl digər əmirlərdən daha öncə Mirzə Sultan Məhəmmədin

---

[763] Dövlətşah təzkirəsində və “Əhsənüt-təvarix” nüsxələrində “Qazı İmaməddin” yazılmışdır. Lakin həmin hadisələrin şahidi olmuş “Kitabi-Diyarbəkriyyə” müəllifi Əbu-Bəkr Tehrani “Qazı Əminəddin” yazdığı üçün Ə.Nəvai onun versiyasını əsas götürmüşdür *(Tehran nəşri, s.415)*.

[764] Şərəfəddin Əli Yəzdi – Teymurilərin saray tarixçisi və “Zəfərnamə” əsərinin müəlifi (bax: *Şərəfəddin Əli Yəzdi. Zəfərnamə /Azərbaycan tarixinə dair seçmələr/. Fars dilindən tərcümə, ön söz və izahlar V.Piriyevindir. Bakı: Azərnəşr, 1996*).

[765] “Səvahibi-Səfəviyyə” ifadəsinin hərfi mənası “Səfəviyyə sahibləri” deməkdir. Mətnin bu yeri “Kitabi-Diyarbəkriyyə”dən götürülmüşdür. Adı çəkilən mənbənin Azərbaycan türkcəsinə tərcüməsi zamanı bu ifadə “Səfəvi müridləri” şəklində tərcümə edilmişdir *(Əbu-Bəkr Tehrani. Kitabi-Diyarbəkriyyə. Bakı, 1998, s.154)*. Mümkündür ki, burada Səfəviyyə təriqətinə mənsub bəzi şəxslər nəzərdə tutulmuşdur.

[766] Mürtəza (ərəbcə “bəyənilmiş” deməkdir) – Həzrət Əlinin ləqəblərindən biri.

[767] Nəcəf – müasir İraqda, Fərat çayının sağsahil hissəsində şəhər. Həzrət Əlinin məzarı Nəcəf şəhərindədir.

yanına çatdı və faydalı nəsihətlər, ürəyə yatan öyüdlər edib şahzadəni yüksək dərəcəli babasının hüzuruna getməyə razı saldı. Amma o əsnada heç kəsin könül aynasında əks olunmamış bir hadisə üz verdi.

**Ölümlər**

Şahrux padşah ibn Əmir Teymur Kürəkan ibn Əmir Torağay ibn Əmir Bərkəl ibn Əmir İləngir ibn Əmir İcəl ibn Əmir Qaracar Noyan ibn Əmir Suğuçin ibn Ərdəmçi Barlas[768] ibn Qaçulay Bahadır ibn Tumanay xan ibn Baysunqur xan ibn Qaydu xan ibn Dutəmənin xan ibn Buzəncir xan ibn Alan Quvay bint Çubinə ibn Yulduz ibn Mənkil Xoca ibn Teymurtaş ibn Qıyan ibn Elxan.

O həzrət qışlaq mənzilində bəzən mədə ağrısından şikayət etsə də, heç bir vəchlə onun görkəmində zəiflik əlamətləri görünmədi. Yekşənbə gününün səhərində, sözügedən ilin zilhiccə [ayının] 25-də (13.03.1447), Novruzun ilk gününə müvafiq olan bir gündə bir qatıra minib, qədim Rey şəhərində yerləşən keçmiş övliyaların, dərin bilikli alimlərin və din müctəhidlərinin mübarək məzarlarını [ziyarət etmək] üçün ehram bağlayaraq o ruh oxşayan məqama və o ürək açan məkana getməyi niyyət etdi. [Qatıra] mindiyi vaxt Şeyx Əlaəddin Simnani[769] müridlərindən olan bir dərviş dedi:

- Bu gecə yuxuda həzrət peyğəmbərin onun paltarından tozu sildiyini gördüm.

Qazı Əbu-Bəkr Tehrani[770] dedi:

- Toz silmək, torpaqdan olan bədəni ruhdan ayırmaq mənasındadır.

Qatır əyyamın atı kimi ipə-sapa yatmadıqda, o həzrət taqətsizliyinin çoxluğu üzündən kəcavəyə mindi. Həmin an mədəsini şiddətli ağrı bürüdü. Şah və ordu yoldan geri döndülər. Günəşə bənzər bargaha çatmazdan öncə [dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin padşahı Tanrının rəhmətinə qovuşdu. Yatmış fitnə nərgiz kimi gözünü şuxluq və abırsızlıq etmək üçün açdı. Mötədil ədalət bənövşə kimi başını heyrət dizinin üzərinə qoydu. Əmin-amanlıq və asayişin gül fidanı yarpaq açmaq və bar verməkdən məhrum qaldı. Sevinc vay-şivənlə, bayram matəmlə əvəz olundu.

O həzrətin zamanında məmləkətlərin abadlığı ən yuxarı həddə çatmışdı. Rəiyyətin və ordunun xoşhallığı son dərəcə yüksəyə yetişmişdi. Dövlətşahın tarixində qeyd edilir ki, Reyin Fəşapuyə [adlı yerində] baş tutmuş bu qışlaq zamanı ordubazarda on iki min dükan sayılmışdı[771]. O həzrətin ömrü yetmiş iki il, səltənət müddəti isə qırx üç il olmuşdur. Məmləkətləri İraq, Fars, Xuzistan, Kirman, Xorasan, Xarəzm, Qəzneyn, Kabil, Təbəristan, Mavəraünnəhr, Türküstan, Kaşğar və Fərqanə[772] idi.

Dehlidə, Aqrada[773] və Qanq çayı kənarına qədər uzanan ərazilərdə hökm sürən Hindistan padşahı Xızır xan[774] onun adına sikkə kəsdirmişdi və ona xərac verirdi. Cahanşah padşah Azərbaycandan onun üçün peşkəş göndərirdi. Şirvan padşahı Əmir Xəlilulla, Gilan, Mazandaran, Rüstəmdar, Böyük Lur və Kiçik Lur hakimləri, Lar və Hörmüz hakimi və Bədəxşan padşahı ona xərac verirdilər. Qara Osman Diyarbəkrdə onun adına sikkə kəsdirmişdi. Səltənəti müddətində altı savaş etmiş və heç bir döyüşdə məğlub olmamışdır: birinci savaşı Pirək padşahla; ikinci savaşı Mirzə Ömərlə; üçüncü savaşı Şeyx Nurəddinlə; dördüncü savaşı Ömərşeyx oğlu Mirzə İsgəndərlə; beşinci savaşı Qara Yusif Türkmanın oğulları ilə; altıncı savaşı Mirzə İsgəndərlə, Mirzə Cahanşahla və Qara Yusifin övladları ilə olmuşdur.

O həzrət həmişə fazillər və mövlalarla söhbət edərdi. Onun məclisində pəncşənbə və cümə günləri xoş avazlı hafizlər[775] Aləmlərin Sahibinin (Allahın) kəlamını oxumaqla məşğul olurdular. Şairlərdən biri həmin hadisə barədə demişdir:

---

768 Əmir Teymurun məzar kitabəsində Ərdəmçi Barula yazılmışdır *(İ.Aka. Mirza Şahruh, s.5).*

769 H. 659-736 / m. 1260-1335-ci illərdə yaşamış iranlı sufi şeyxi *(Öztürk, şərhlər, s.259).*

770 Mövlana Əbu-Bəkr Tehrani – Ağqoyunlu hökmdarı Uzun Həsənin saray tarixçisi və "Kitabi-Diyarbəkriyyə" əsərinin müəllifidir (bax: *О.А.Эфендиев. «Китаб-и Дийарбакрийе» Абу Бакра Тихрани как исторический источник // Источниковедческие разыскания – 1982. Тбилиси, 1985, с.112-118; Əbu-Bəkr Tehrani. Kitabi-Diyarbəkriyyə. Fars dilindən tərcümə edən, ön söz, şərhlər və göstəricilərin müəllifi: R.Şükürova. Bakı, 1998*).

771 Əgər burada Dövlətşahın təzkirəsi nəzərdə tutulursa, orada belə bir məlumat yoxdur *(Nəvai, şərhlər, s.421).*

772 Fərqanə vadisi – Tyanşanda dağlararası çökəklikdir. Bu vadi hal-hazırda Özbəkistan, Qırğızıstan və Tacikistan respublikalarının tərkibinə daxildir. Özbəkistanın şərq hissəsində mərkəzi Fərqanə şəhəri olan Fərqanə vilayəti mövcuddur.

773 Aqra – Hindistanın şimalında, Dehlidən cənubda, Uttar-Pradeş ştatında şəhər.

774 1414-1421-ci illərdə Dehli sultanı olmuşdur *(Nəvai, şərhlər, s.421).*

775 Hafiz – "Qurani-Kərim"i əzbərdən bilən şəxslərə verilən titul.

Şeir

"Zəmanənin padşahı, Allah onun torpağını pak etsin,
O, Keyqubadın və Keyxosrovun[776] varisidir.
İl təhvil olan vaxtda getdi bu dünyadan,
Novruz sübhü idi və işıq (gün) doğuşu vaxtı idi".

"Novruzun sübhü" ("sübhi-novruz") "nun" hərfini, "işığın doğuşu" (mətleyi-zöv") isə "zad" hərfini bildirir[777].

O həzrətin yeddi oğlu vardı: Mirzə Uluğ bəy, Mirzə İbrahim sultan, Mirzə Baysunqur, Mirzə Süyurqatmış, Mirzə Məhəmməd Cuki, Bardı və Canoğlan. O həzrətin başına belə bir böyük iş gəldiyi (vəfat etdiyi) zaman onun Uluğ bəydən savayı heç bir oğlu həyatda deyildi. O vaxt Uluğ bəy Mavəraünnəhrdə və Mirzə Əlaüddövlə Heratda idi. Mirzə Abdulla ibn Mirzə İbrahim sultan ibn Şahrux Farsda, Mirzə Sultan Məhəmməd Luristanda, Mirzə Əbdüllətif orduda, Mirzə Əbu-Bəkr ibn Mirzə Məhəmməd Cuki Xüttəlanda, Mirzə Süyurğatmışın oğulları Mirzə Sultan Məsud və Mirzə Qaracar isə Kabildə idilər.

Gövhərşad bəyimin işarəsinə uyğun olaraq, Mirzə Əbdüllətif qoşunun başına keçdi. Mirzə Məhəmməd Cahangirin oğlu Mirzə Xəlil sultan Xorasana hərəkət etdi. Onların əsgərləri ordubazarı tarac etdilər. Mirzə Əbdüllətif ordubazarın ətrafına gəlib bir neçə nəfəri cəzalandırdı və ordugahda nəzarəti ələ keçirdi.

Möhnətli hadisənin baş verməsindən üç gün sonra mərhumun cəsədini məhfəyə qoyub səfil və pərişan vəziyyətdə, gözləri ağlar və sinələri sızlar halda Xorasan tərəfə yola düşdülər. Xərvəyə[778] çatdıqları vaxt bir dəstə fitnəkar adamlar Əbdüllətifə dedilər ki, "Gövhərşad bəyim tərxanlılarla[779] ittifaq halında xəyanətə hazırlıq görməkdədir". Buna görə də tərxan [tayfasının] əmirlərinin malları və əşyaları qarət olundu. Onların əksərini bağlayıb həbs etdilər. Gövhərşad bəyimin mallarının qarət olunmasında o dərəcədə ifrata vardılar ki, köç edən zaman Gövhərşad bəyim minməyə bir ulaq belə tapmadı. O, çarəsizlikdən belinə bir miqdar bez bağlayıb, əlində əsa tutaraq piyada hərəkət etməyə başladı. Barlas əmirlərinin mülazimlərindən biri son dərəcə yaxşı bir atı Gövhərşad bəyimin önünə çəkib onu mindirdi.

Mirzə Əbdüllətif Simnana çatdıqda eşitdi ki, Əmir Hindukənin xahişi ilə Mirzə Babur Astarabada tələsmiş və padşahlıq taxtında oturmuşdur. Həmçinin o əsnada xəbər çatdı ki, Əmir Sultanşah Barlas, Mirzə Sultan Məhəmmədin ordugahına getmiş digər əmirlərlə birlikdə qayıtmışlar və hüzura gəlməkdədirlər. Əmir Şeyxi Əbülfəzl orada qaldı və Əmir Əhməd Firuzşah Şiraz[780] yolundan Herata tələsdi. Əmir Sultanşah ali məiyyətə qoşuldu.

Həmçinin Mirzə Əbdüllətif Nişapurda eşitdi ki, Mirzə Əlaüddövlə xəzinələrin qapılarını açaraq kiçiklərə və böyüklərə çoxlu qızıl vermiş və onu dəf etmək üçün bir dəstə qoşun göndərmişdir. O, son dərəcə qüruru üzündən buna məhəl qoymayıb yola çıxdı və onu tutdular.

Bu əhvalatın təfsilatı belədir ki, Şahrux padşahın [ölüm] hadisəsi baş verdikdən sonra Gövhərşad bəyim şimal və səba küləklərinə tay olan bir qasidi Herata göndərib vəziyyətin nə yerdə olduğunu bildirdi. Mirzə Əlaüddövlə öz fikrində qərar verdi ki, Mirzə Uluğ bəyə itaət edib Səmərqəndə külli məbləğ göndərsin. Amma Mirzə Əbdüllətifin Gövhərşad bəyimə qarşı hörmətsizlik etdiyinə dair ordudan xəbər gəldikdən sonra bu, onun ürəyinə ağır gəldi və İxtiyarəddin qalasına gedib, xəzinələrin qapılarını açaraq qüvvətlilərə və zəiflərə çoxlu qızıl bağışladı. O, Mirzə Pir Məhəmməd Şirazinin oğlu Mirzə Salehi[781], Üveys Tərxan, Əhməd Tərxan və bir sıra digər şücaətlilərlə birlikdə Mirzə Əbdüllətifi dəf etməyə göndərdi. Qalib qoşun Nişapur ətrafında Mirzə Əbdüllətifin üstünə hücum etdi. Uzun döyüşdən sonra pis əməl sahibi olan şahzadəni (Mirzə Əbdüllətifi) tutub Herata apardılar. Mirzə Əlaüddövlə, Mirzə Əbdüllətifə xitabən dedi:

- Öz anana qarşı nə üçün hörmətsizlik etdin?

Mirzə Əbdüllətif dedi:

---

[776] Keyqubad və Keyxosrov – qədim İranda hökmranlıq etdiyi bildirilən yarıməfsanəvi hökmdarlardır.

[777] "Nun" və "zad" hərflərinin əbcəd hesabı ilə cəmi Şahruxun ölüm tarixi olan 850-yə bərabərdir *(Nəvai, şərhlər, s.422).*

[778] Digər mənbələr bu hadisənin Reyin Xəvarı ilə Simnanın Sürxəsi arasında baş verdiyini yazırlar. Sürxə – Simnandan 4 fərsəx aralıdır. Lakin həmin ərazidə Xərvə adlı yerə təsadüf edilmir *(Nəvai, şərhlər, s.423).*

[779] Tərxanlılar Gövhərşad bəyimlə eyni tayfadan idilər *(Nəvai, şərhlər, s.423).*

[780] "Həbibüs-siyər"ə görə: Turşiz *(Nəvai, şərhlər, s.424).*

[781] Mirzə Saleh ibn Pir Məhəmməd ibn Ömərşeyx ibn Teymur Kürəkan *(Nəvai, şərhlər, s.424).*

- Mən pislik etdim, cəfa gördüm. Sən yaşılıq et ki, vəfa görəsən.

Bundan sonra onu İxtiyarəddin qalasında məhbus etdilər. Şahrux padşahın cəsədini Gövhərşad bəyim mədrəsəsində dəfn etdilər.

Şahrux padşahın vəfatından sonra Mirzə Sultan Məhəmməd az adamla Qum şəhərinə gəldi. Əmir Şeyx Hacı İraqi və Əmir Səadət Xavəndşah oğlu divan əmiri oldular. Şeyx Əbülfəzl Əleykə əmirlərin möhürünün üzərindən möhür vurdu (onlardan daha üstün bir mövqeyə yüksəldi). Xoca Mahmud Heydər Üştürcani əvvəlki qaydada vəzirlik bayrağını yüksəltdi. Reydə həbsdə olan Şah Nizaməddin Gülüstanə, Şah Qivaməddin Hüseyn və Əmir Ruzbehan kimi İsfahan seyidləri "Həsən padşahın tarixi"nin[782] müəllifi Qazı Əbu-Bəkr Tehrani ilə birlikdə o şəhərdə dərgaha gəldilər. Mirzə Məhəmməd soyurğallar və ənamlar haqqında hökmlər verdi və Reyə yönəlib o həzrətin (Şahruxun) mənzilində qaldı. Ondan sonra çoxsaylı ordu ilə İsfahana tələsdi. O cənnət nişanlı şəhəri zəbt etdikdən sonra Şiraz tərəfə getdi.

Mirzə Abdulla o ali məqamlı şahzadənin gəlişindən agah olduqda, Fars vilayətindən müqayisəyəgəlməz bir qoşun toplayıb qarşıdurma və vuruşma üçün Şirazdan çıxdı və o məmləkətin qalasını möhkəmləndirdi. Neçə gün aləmi yandıran o iki ordu bir-birinin qarşısında qərar tutdular. O əsnada Əmir Hacı Məhəmməd Qanaşirin Kirmandan gəlib Sultan Məhəmmədin ordusuna birləşdi. Sultan Məhəmməd bir yol tapıb dağ başına çıxdı. Mirzə Abdulla da onu qarşılamağa gəldi. İki tərəf arasında böyük bir hərb baş verdi. Mirzə Abdulla məğlub olub möhnətlər içində İstəxr qalasına[783] pənah apardı. Fars [vilayətinin] ordusundan müqayisəyəgəlməz qənimət ələ keçirildi. Mirzə Sultan Məhəmməd yüz izzət və dəbdəbə ilə Şiraza daxil oldu. O diyarın əyan-əşrəfi onun hüzuruna tələsdilər. O, Seyid Əhmədi elçi kimi İstəxr qalasına göndərdi. Adı çəkilən seyid, Mirzə Abdulla ilə görüşüb onu Mirzə Sultan Məhəmmədin dərgahına gətirdi. Mirzə Sultan Məhəmməd ona dedi: "İraq və Fars şəhərlərindən hansını istərsən, sənin olsun. Əgər Xorasana getmək istəsən, sənə mane olmarıq". Mirzə Uluğ bəy onu özünə kürəkən edəcəyinə dair vəd verdiyi üçün Mirzə Abdulla Xorasana yollandı. O diyara çatdıqda Mirzə Əlaüddövlənin xidmətində qaldı.

### Şahrux padşahdan sonra Mirzə Uluğ bəyin əhvalı haqqında söhbət

Qeyb sirlərini bilən həzrət (Allah) kifayət qədər hidayət və yetərincə hüsn-rəğbət ilə Ərəstu[784] səviyyəli padşah olan Uluğ bəyin tərifli aqibətə malik dövlətinin məsud talelərini "Biz səni yer üzündə xəlifə etdik"[785] [ayəsinin] uca dan yerindən doğmaqla şərəfləndirdi. Kəramət açarları ilə dünyanın müxtəsər ləvazimatını əldə etmək qapılarını birbaşa surətdə onun səltənətinin parlaq günəşinin üzünə açdı. Onun saysız nurların qəndillərinin işıq saçdığı qəlbinin parlaq ulduzları aydın fikrinin işarəsi və doğru düşüncəsinin yönləndirməsi ilə din açarlarının çırağı və müşkül həqiqətlərin kəşfedicisi olub, "Biz onu yüksək bir məqama qaldırdıq"[786] [ayəsinin] zirvəsinə çatdı.

Səltənət taxtına əyləşdikdən sonra Mavəraünnəhr və Türküstan ordusu ilə Xorasanı ələ keçirmək əzmi ilə yola çıxdı. Ceyhun sahili [dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin hökmdarının keçid yerinə çevrildikdə belə bir xəbər gəldi ki, Mirzə Məhəmməd Cukinin oğlu Mirzə Əbu-Bəkr Ərhəng[787], Sarısaray, Xüttəlan, Qunduz və Bəğlan vilayətlərini zəbt etmişdir. [Uluğ bəy] onun yanına elçilər göndərib onunla qohum olacağına söz verdi və ali dərəcəli şahzadə öz böyük əmisinin ordusuna üz tutdu. Bir neçə gündən sonra Uluğ bəy onu tutub Səmərqəndə göndərdi. Daha sonra isə Bəlxdə dayanıb gözlədi ki, Mirzə Əbdüllətif Nisa yolundan gəlib ali məiyyətə qoşulacaqdır.

Bu əsnada o, möhtərəm oğlunun dustaq edilməsindən xəbər tutdu. O, Əmir İbrahim İdigü[788], Əmir Əbu-Bəkr, Bəyan Teymur və Əmir Bayəzid kimi əyanlar və əmirlərlə oğlunun xilası barədə məşvərət etdi. Onlar ərz etdilər ki, "Mirzə Əlaüddövləyə qarşı sülh qapısından getmək lazımdır; yalnız o zaman padşahlıq sandığının gövhəri Bədəxşan ləli mədəndən çıxdığı kimi zindandan çıxar".

---

[782] "Kitabi-Diyarbəkriyyə" nəzərdə tutulur.
[783] İstəxr – İranın Fars vilayətində, Şiraz şəhərindən şimal-şərqdə yerləşən qala.
[784] Ərəstu (Ərəstun) – qədim yunan filosofu Aristotel (m.ö. 384-322). O, Makedoniyalı İsgəndərin müəllimi olmuşdur.
[785] *Qurani-Kərim, "Sad" surəsi, 26-cı ayə.*
[786] *Qurani-Kərim, "Məryəm" surəsi, 57-ci ayə.*
[787] Ərhəng – Bədəxşan vilayətində bir qəsəbə *(Öztürk, şərhlər, s.265).*
[788] Yəni Əmir İdigünün oğlu Əmir İbrahim.

Mirzə Uluğ bəyin gəlişindən xəbər tutan Mirzə Əlaüddövlə böyük bir ordu ilə Mürğab çayından keçdi. Mirzə Uluğ bəy, Mirək Mahmudu elçi kimi göndərib xəbər verdi ki, “o əziz, möhtərəm və müzəffər oğlumun məmləkətinə zərər vermək mənim ürəyimcə deyildir. İndi əgər Əbdüllətifi bu tərəfə göndərsən, münaqişə tamamilə ortadan qalxar”.

Bu əsnada Cürcanı istila etmiş Mirzə Əbülqasım Babur Xorasan vilayətini ələ keçirmək əzmi ilə Cürcandan çıxıb köçə-köçə Tus vilayətinə çatdı və bir dəstəni mənqəlay şəklində irəli göndərdi. Mirzə Əlaüddövlə də Cam vilayətində çoxlu qoşun saxlamışdı. Onlar bir-biriləri ilə müharibə etdilər. Mirzə Əlaüddövlənin əmirlərindən olan Məhəmməd Pirzad əsir alındı. Mirzə Baburun qoşunları Herata qədər gəlib çıxdılar və istila bayrağını ucaltdılar.

Bu möhnətli xəbər Mirzə Əlaüddövləyə çatdıqda Herata qayıtdı. Mirzə Əbdüllətifi həbsdən çıxarıb Mirzə Uluğ bəyin yanına göndərdi. Mirzə Uluğ bəy Bəlx vilayətini Mirzə Əbdüllətifə tapşırıb Səmərqənd tərəfə yollandı.

Mirzə Əlaüddövlə, Mirzə Uluğ bəylə sülh bağladıqdan sonra o məkana gəlib ordunun əksər hissəsini Baburla savaşmağa göndərdi. Mirzə Babur Ümman dənizi kimi coşan və gurlayan bir qoşunla Xəbuşan vilayətinin hüdudunda ordu səfi çəkmişdi. Xeyirxahlar araya girib sülh etdilər ki, iki məmləkət arasında sərhəd Xəbuşan mövqeyi olsun.

Mirzə Babur sülhdən sonra köhlən atının yüyənini Mazandaran tərəfə döndərdi. Orada o diyarın valisi Seyid Məhəmməd div kimi mazandaranlılardan [ibarət] çoxsaylı ordu ilə savaşa və döyüşə yollandı. Davadalaşdan sonra Seyid Məhəmməd məğlub olub meşəyə qaçdı, üzrxahlıq və ah-zar qapısından içəri girdi. Ali məqamlı padşah o diyarı ona tapşıraraq seyidin qızlarından biri ilə evləndi və Cürcana qayıtdı.

## 851-Cİ İLDƏ (19.03.1447 – 06.03.1448) BAŞ VERMİŞ HADİSƏLƏR

### Ali məqamlı Cahanşah padşahın Cahangir mirzənin və Həsən padşahın üzərinə Diyarbəkrə qoşun göndərməsi

Bu il Əlvənd ibn Mirzə İsgəndər ibn Qara Yusif müxaliflik etməyə başlayıb Ərbili və Kürdüstanı ələ keçirdi. Buna görə də ali məqamlı hökmdar Müzəffərəddin Cahanşah padşah, Rüstəm Tərxanı həddən ziyadə bir ordu ilə Əlvəndi dəf etməyə göndərdi. [Rüstəm Tərxan] sürətli yürüş edib özünü ona yetirdi. Böyük bir döyüş baş verdi. Əlvənd məğlub olub, zəlil və pərişan bir halda, yaşla dolu gözlə özünü Mirzə Cahangirin hüzuruna çatdırdı. Cahanşah padşah elçi göndərib onu tələb etdi. Mirzə Cahangir cavab verdi ki, “o, bizə pənah gətirmişdir və mənim onu sənə təhvil verməyim kişilikdən deyildir”. Üç dəfə elçi göndərdi. Amma bir faydası olmadı. Ona görə də Cahanşah padşah çoxsaylı ordu ilə Gəncədə qışlaq etdi və Ərzincanda olan Osman bəyin oğlu Mahmud bəyin üzərinə Əmir Ərəbşahla Qılıc Aslanın başçılığı altında qoşun göndərdi. Tərcan ətrafında Musa bəy də onlara qoşuldu. Şeyx Həsən bəyin oğlu Bayəzid bəy onları Cahanşah padşahın hüzuruna göndərdi. Piltənin övladlarından Xəlil bəy və İsgəndər də Mirzə Cahanşahın hüzuruna getdilər. O qoşun Ərzincanı mühasirə etməyə getdi.

O zaman Həsən padşah məsləhət gördü ki, “yadın bizə hökm etməməsi və bizə üstün gəlməməsi üçün bizim Mahmud bəyə kömək etməyimiz vacibdir”. Lakin Həsən padşahın təklifini qəbul etmədilər. O səbəbdən Ərzincan [Ağqoyunluların] hakimiyyətinin dairəsindən çıxdı.

Ərzincan əhli kənardan yardım gələcəyindən ümidsiz oldu və onlar özlərinin müdadiə olunmağa qüdrətlərinin yetməyəcəyini gördülər. Mühasirə günləri uzandıqca ərzaq azalırdı. Belə olduqda, əhd-peyman bağlayıb ağır və qəti andlar əsasında Ərzincanı Cahanşah padşaha təslim etdilər. Fəthdən sonra and pozuldu və əhdlər aradan qalxdı. Ərzincanlılar dustaq edilib həbsə alındılar. Dustaqlar arasında heç kimsə yox idi ki, onun Cahangir mirzənin ordusunda qohumluq əlaqəsinə malik bir yaxını, ya atası, ya oğlu, ya qardaşı, ya bacısı və ya bu kimi digər bir əqrəbası olmasın.

Sonra Cahanşah padşah, Əli Ağqoyunlunun oğlu Mirzə İbrahimi elçi kimi Cahangir mirzənin yanına göndərib xəbər verdi:

- Əgər Əlvənd mirzəni mənə versən, mən əsirləri azad edərəm; əks təqdirdə isə onların hamısını qətlə yetirəcəyəm.

Cahangir mirzə cavabında buyurdu:

- Bizə sığınmış adamı ölümə vermək kişilikdən deyildir. Cahanşah padşah Ərzincanı əhd-peyman və and-amanla fəth etdiyi üçün həbs etmək və azad etmək məsələsi ona aiddir, istəsə bağışlar, istəsə öldürər, özü bilər.

Ali məqamlı padşah olan Canahşahın qəzəb alovu bu sözdən sonra alışdı. O, Rüstəm Tərxanın başçılığı altında bir hücum dəstəsi təyin etdi. Onunla birlikdə Cahangir mirzənin əmisi Şeyx Həsən bəy, Musa bəy, bəzi Ağqoyunlu əmirləri və otuz min nəfər hamısı silah, təchizat və ləvazimatla Kəmax və Divrigi yolundan Malatyaya gəldilər və Cahangir [bundan] xəbər tutdu. Əmirlərlə məşvərət (kəngaş) etdi.

Həsən padşah qarşıdurma və vuruşmaya getməyi təklif etsə də, qəbul olunmadı. Cahangir mirzə Amidə yönəldi. Ağqoyunlu əmirlərindən Məhəmməd Bəktaş, Məhəmməd Qoca Hacı, pornak [tayfasından] Əli bəy, Şeyx Həsən mirzəyə havadarlıq etmək üçün Rüstəm Tərxanın yanına getdilər. Qəbilələr də geri döndülər. Bəziləri Sivərək[789] ətrafında, bəziləri də Hümüsdə yerləşdilər. Üveys bəy Ruha (Urfa) qalasını da tərk edib qaçdı. Rüstəm Tərxan Hümüs ətrafında olan dəstəni qarət edib, müsəlmanların qanını və malını alaraq öz muradına uyğun fitnə-fəsad törətdi. Şeyx Həsən bəyə havadarlıq üçün getmiş Ağqoyunlu dəstəsi onun etibarsız olduğunu görüb, getdiklərindən peşman oldular və geri döndülər.

Bu zaman Həsən padşah Ərqənin və Sivərək ətrafında toplanmış qəbilələrin hamısına sahib çıxdı, onları zor və güc yolu ilə Cermük tərəfə apardı. Rüstəm Tərxan Mardin üzərinə gəldi. Böyük bir döyüş baş verdi. Rüstəm Tərxanın qoşunundan Nurulla Cagirlünü və Bədrəddin Ruhulla Ayinlünü əsir tutdular və onların nökərlərindən bir çoxunu tutub qətlə yetirdilər. O, geri döndü. Mirzə Cahangir Mardinə hökm etmək iddiası ilə oraya getdi. Rüstəm Tərxan Mardin ətrafına bir qoşun dəstəsi (səriyyə)[790] göndərmişdi. Onlar yolda həmin dəstəyə çatdılar. Cahangir mirzənin əsgərləri hər tərəfdən onlara hücum etdilər. Lakin az-az gəlib yetişdikləri üçün hamısı öldürüldü. Cahangir mirzə məğlub olub Amidə qayıtdı. Mardin əhli Ağqoyunlulardan ümidini üzüb şəhəri Rüstəmin adamlarına təslim etdi və qala mühasirəyə düşdü. Qar və yağış çox olduğundan və qış son dərəcə sərt və soyuq keçdiyindən, Cermük ətrafında olan heyvanlar və qəbilələr tələf oldular. Həsən padşah şəfqət üzündən onlara icazə verdi ki, istədikləri tərəfə köçə bilərlər. Üveys bəy Ruhanı tərk etdiyi üçün Həsən padşah onu hər məclisdə azarlayırdı. Nəhayət, Üveys bəyin qeyrət damarı hərəkətə gəldi. O, şücaətdə Ağqoyunluların adlı-sanlılarından olan Hüseyn Miraxurla və Sevindik ağanın qəbiləsi ilə ittifaq edib Ruha qalasını Qaraqoyunlulardan aldı. Rüstəm, Şeyx Həsən mirzənin, Sarı Əlinin oğlunun və Şeyx Məhəmmədin başçılığı altında bir qoşun təyin etdi və onları Ruha qalasını mühasirə etməyə göndərdi. Bu vaxt Həsən padşah Ərqənin qalasında idi.

O, qalanın mühasirəsindən və qardaşının çarəsizliyindən xəbərdar olduqda öz şəxsi (xassə) qoşunu ilə Cahangir mirzənin xidmətinə gəldi və qoşun toplayıb Ruha tərəfə üz tutdu. Qaraqoyunlular şəhərin hasarını möhkəmlətmişdilər. Rüstəm Mardində idi. Həsən bəy qalaya yol tapmadı. Axırda Babüssirr ("sirr qapısı") yolundan qalaya daxil oldu. Qoşun başçıları ilə məşvərət (kəngaş) etdi ki, qaladan şəhərə daxil olsunlar. Hamısı buna qarşı çıxdılar və dedilər:

- Şəhərdə düşmənlərdən min iki yüz nəfər var. Biz isə cəmi üç yüz nəfərdən artıq deyilik. Məkan çox dardır və şəhər olduqca istehkamlıdır. Döyüşməyə macal tapmayacağıq və ölümün pəncəsində giriftar olacağıq.

Həsən padşah onların sözünü qəbul etməyib dedi:

- Biz gedəcəyik və Haqqın (Allahın) yardımı ilə zəfər qazanacağıq.

O, Babüssirr yolundan şəhərin içinə daxil oldu. Qaraqoyunlular şəhər qapılarını bağlamışdılar. Böyük bir döyüş etdi. Onlar qaçış yolunu bağlayıb Həsən padşahın qoşununun ön dəstəsini məğlub etdilər. Axırda qalaya qaçdılar. Həsən padşah arxadan yetişib öz qoşununun Qazıoğlu Əli, Tərkən və Məhəmməd Əzəb kimi bahadırlarını piyada etdi. Onlar körpü üzərində mərdliklə döyüşdülər. Qaraqoyunlu qoşununun xəbəri olmadan Üveys bəyi şəhərin içindəki çadırından (qərargahından) çıxardılar. Buyurdu ki, Qaraqoyunluların arxasından gəlin ki, onlar şəhərin içindən kömək gəldiyini zənn etsinlər. Üveys bəy arxadan gəldiyi zaman arxa tərəfdə igidlərin qovğası və hay-küyü qalxdı. Həsən padşah öz şərəfli vücudu ilə döyüş meydanı-

[789] Sivərək – Türkiyənin Şanlıurfa vilayətinin bir ilçəsi.
[790] Səriyyə – sayı 5 nəfərdən 300-400 nəfərə qədər olan kiçik qoşun dəstəsi *(Nəvai, şərhlər, s.431).*

na üz tutdu. Düşmənlərdən çoxsaylı bir dəstə Həsən padşahın üzərinə gəldi. Bir göz qırpımında böyük bir döyüş baş verdi. Həzrət Pərvərdigarın mədədi, yardımı və köməyi ilə Rüstəmin adamları məğlub oldular. Onlar bütün mallarını, atlarını və əşyalarını buraxıb piyada oldular və xarabalıqlara qaçdılar. Ağqoyunlular onların üstünə gəldilər və onları əsir etdilər. Şeyx Əli Möhürdar, Şeyx Həsən mirzəyə çatdı və ona bir qılınc vurdu. Məhmad bəy də özünü yetirib ona bir qılınc vurdu. Mir Hüseynin oğlu da bir nizə vurdu. Axırda Habil bəyin oğlu Xəlil ona bir nizə vurdu və xülasə, onu atdan salıb bağlayaraq Həsən padşahın yanına gətirdilər. Rəbbani lütfkarlığın köməyi və Sübhani hidayətin yardımı ilə həmin üç yüz nəfər, min iki yüz nəfərə qalib gəldi və onların həyat damarını qırdı. Şeyx Həsən mirzəni şəhərdə tutulmuş bütün Qaraqoyunlu əmirləri ilə birlikdə qətlə yetirdilər. Şəhər qapıları bağlı olduğundan və ixtiyar Ağqoyunluların əlinı keçdiyindən, heç kim [şəhərdən] kənara çıxa bilmədi. Göylərin qala kutvallarının gözü bu torpaq şəhərbəndi müşahidə etdiyindən bəri heç vaxt belə bir hadisə baş verməmişdir.

Şeyx Həsənin başını Misirə, əlini isə Amidə göndərdilər. Məhəmməd Bəktaşın dönük çıxmış və Şeyx Həsənə havadarlıq etmək üçün getmiş oğlunun başını Həsən padşah öz əli ilə kəsdi, Vəli bəy Pornakı, Əli bəy Pərvanəni və Məhəmməd Qoca Hacını isə dustaq edib Amidə göndərdi. Əli bəy Pərvanəni Xızır bəy Tərxan, Məhəmməd Qoca Hacını Xəlil İdris, Məhəmməd Bəktaşı Həsən padşahın nökəri olan Qaraqoyunlu Məhəmməd, Sarı Əlinin oğlunu Həmzə Əmiraxuroğlu və Dəmirçi Şeyx Məhəmməd, Əli Yeganı Hüseyn Əmiraxur və Əli İnağı Qazıoğlu Əli əsir etdi. Bu müddətdə Ağqoyunlu qövmləri Xabur və Şinə çaylarının qovuşduğu yer olan Şinə mövqeyində[791] idilər. Bu xəbər dəqiq məlum olduqda o qəbilələrdən bəziləri Həsən padşaha meyil göstərdilər, bəziləri isə Süleyman Zülqədərin xidmətində olan böyük əmirin (Qara Osmanın) oğlu Qasım mirzəyə üz tutdular və Qaraqoyunluların şərindən və zərərindən özlərini xilas etdilər. Bu qələbədən sonra Həsən padşah Amidə yönəldi və öz qardaşı Cahangir mirzəyə peşkəşlər göndərdi. Sonra öz ölkəsi olan Ərqəninə yola düşdü. Rüstəm mirzə Mardin qalasını mühasirə etməklə məşğul idi. Bu zaman o, həmin qalanın mühasirəsi üçün kifayət edəcək qədər qoşun qoyaraq öz ordusu ilə qışlağa yollandı və Həsən padşahı dəf etmək üçün oradan Birəcük qalasına doğru sürətli yürüş etdi. O həzrət Mal-öyüklü[792] deyilən mövqeyə gəldi və oradan Cermük ətrafına köç etdi. Rüstəm Tərxan oradakı bəzi elləri, Şama bağlı olan Sivərək elini və Qaramağaranı[793] qarət etdi və Büxur-bulaq yolundan Amid tərəfə gəldi. Amidin taxılını yedilər və Ərqənin qalasına doğru yönəldi. Ərqəninin altı fərsəxliyindəki Rəmaktun[794] mövqeyi onun əzəmətli çadırlarının qurulduğu yer oldu. [Həsən padşah] əmr etdi ki, Ərqənin qəbilələri və əhalisi köç edib Şama bağlı olan Xarputa getsinlər. O, Ağqoyunlu qəbilələrinin qalanını da xassə ordugaha (özünə məxsus olan ordugaha) köçürüb Mehrimar[795] tərəfə yönəldi. Rüstəm o həzrətin ardınca sürətli yürüş etdi. Qəbilələrin qalanları ki o həzrətlə birlikdə idilər, pərən-pərən düşdülər. Hərçənd Həsən padşah onları ürəkləndirməyə çalışdı və onları sabitqədəm olmağa təşviq etdi, lakin faydası olmadı. Sonra qaravuldan xəbər gəldi ki, Rüstəm Malan kəndinə[796] çatmışdır. Sonra onun ardınca yenə xəbər gəldi ki, Rüstəm gəlib çatmışdır. Həsən padşah Fərata axan Ağsu-yi-Mehriban çayının başında mövqe tutdu. Rüstəm Mehrimarda dayandı.

Həsən padşahın əsgərləri qılınclarını çəkdilər və Qaraqoyunlulara hücum etdilər. Ağqoyunluların heybəti onlara qalib gəldi və onlar müqavimət göstərməkdən və müdafiə olunmaqdan aciz qaldılar. Sonra gecənin əvvəlində [Həsən padşah] o məkandan köçüb, çayın kənarını tutaraq Fərat tərəfə bahar seli və yaz küləyi kimi rəvan oldu. Yükləri və heyvanları köçdən öncə göndərmişdi. Dəvələri Çulkuna yolladı. Rüstəm Tərxan, Tahir suyuna (Abi-Tahir)[797] birləşən Murdan suyu (Murdan-ab) yolundan hərəkət etdi ki, pərən-pərən düşüb o yoldan getmiş qəbilələri qarətə və əsarətə məruz qoysun. Həsən padşah otuz beş adamla iki fərsəxlikdə olan bir dağın başına çıxdı. Sahibqiranın (Həsən padşahın) sağında Qaraqoyunluların bir süvari qo-

[791] Xabur çayı – Türkiyənin Hakkari dağlarından başlayıb Dəcləyə tökülən bir çaydır. Şinə - Hakkaridə dərədir.

[792] Mal-öyüklü – bu gün Türkiyənin Çermik ilçəsində Mal Üyüğü adlı bir təpə və Mal Önü adlı bataqlıq bir yer vardır *(Öztürk, şərhlər, s.270).*

[793] Qaramağara – Türkiyənin Adıyaman vilayətinin Kahta ilçəsinə bağlı bir kənddir *(Öztürk, şərhlər, s.271).*

[794] Nüsxələrdə "Zənkəbutər", "Zəmkəbutər" şəklində yazılıb.

[795] Mehrimar – nüsxələrdə Mehrifər və Mehrimaz şəklində də yazılmışdır. Buranı Erqanidə İlan Quyusu deyilən Birimar adlı yerlə və ya Gölcük gölünün cənubundakı Bəhrəmaz adlı yerlə eyniləşdirmək mümkündür *(Öztürk, şərhlər, s.271).*

[796] Malan – yəqin ki, burada Diyarbəkrin Diclə ilçəsinə bağlı olan Şeyx Malan (bugünkü Təpəbaşı) kəndi nəzərdə tutulur.

[797] Abi-Tahir (Tahir suyu) – Fərat sahilində Əbu-Tahir kəndi vardır *(Öztürk, şərhlər, s.271).* Əbu-Tahir kəndinin indiki adı Doğanbağı olub, hazırda Türkiyənin Elazığ vilayətinin Sivrice ilşəsinə daxildir.

şunu dayanmışdı. Onlardan başqa bir qoşun da sol tərəfdə pusqu qurmuşdu. [Ağqoyunluların] sağ və sol qoşunu yad qoşunla üzləşdiyi zaman Həsən padşah otuz beş süvarini onlarla döyüşməyə göndərdi. Onlar düşmənlərdən səksən nəfəri məğlub edib, bir neçə nəfəri tutaraq dərgaha göndərdilər. Xülasə, bu hadisə zamanı Rüstəm Tərxanın adamlarından beş yüz nəfəri qətlə yetirdilər.

O əsnada Ömər Əmirlü və Xızır bəy Tərxan yetişdilər və ərz etdilər ki, "Mardin qalasına savaşa getmiş Cahangir mirzə məğlub olmuşdur". Bu, onun (Həsən padşahın) dünya əhlini bəzəyən düşüncəsinə ağır gəldi.

Bu əsnada Rüstəm Tərxan öz oğlu Tərxanı, qardaşı Cahangir Tərxanı və Əbdülqəffar Şəkini Həsən padşahın üzərinə göndərdi. O həzrət xəbərdar olub, özünü Amidə saldı. Düşmən qoşunu oranın həndəvərinə çatdıqda, Həsən padşah müzəffər süvarilərdən [ibarət] bir dəstə ilə onlara həmlə edib iti qılınc zərbəsi ilə o fitnənin tozunu yatırdı. Onların bir çoxları əsir oldular.

Ertəsi gün Rüstəm Tərxan çoxsaylı ordu ilə Qutul qalası üzərindən Amid ətrafına endi. Onun qoşununun əksəri qara geymişdi. Çünki onların adamları öldürülmüşdü. O, elçilər göndərib, əhd-peyman bağladıqdan sonra əsirləri dəyişərək Amid ətrafından köç etdi.

Rüstəm Tərxanın geri dönməsi xəbəri Cahanşah padşaha çatdıqda Məhəmmədi mirzəni böyük bir ordu ilə Rüstəm Tərxanın köməyinə yolladı. Məhəmmədi mirzə dəmir sədd kimi ordu ilə Həmid ətrafında dayandı. Cahangir mirzə şəhərə sığınıb, Xəlil adlı mülazimini qardaşı Həsən padşaha göndərərək yardım istədi. Buna görə də o həzrət qəbilələri toplayıb düşmənlərin üzərinə yollandı və Qaraqoyunlu ordusunun qaravullarına çatıb həmlə etdi. Onlar Həsən padşahın ordusunu pərən-pərən saldılar. Belə ki, o həzrətin yanında on iki nəfərdən başqa heç kim qalmadı. Onlar da ondan üz çevirdilər.

Həsən padşah atını çapıb Əbdülqəffar adlı birini yəhərin üzərindən yerə saldı. Bu əsnada gözünün altına bir ox dəydi. Belə ki, hər iki göz qapağını bir-birinə tikdi. Ona görə də Rüstəm Tərxan onun nizəsindən xilas oldu. Məhmad bəy oxu Həsən padşahın gözündən çıxardı. Düşmənlər hücum etdilər və böyük bir savaş oldu. Hər iki tərəfdən bir çoxları yaralandılar və öldülər. Axırda cəngavərlər bir-birindən əl çəkdilər.

Rüstəm Tərxan bu döyüşdən qayıtdıqdan sonra Həmidə yönəldi. Şəhər camaatı onların döyüşdə atdıqları və Həsən padşahın mülazimlərinin şəhərə gətirdikləri sarıqları və papaqları onlara göstərirdilər. Fahişə qadınlar[798] sarıqları başlarına taxıb onlara söyüş söyürdülər və Məhəmmədi mirzə ilə Rüstəm Tərxanı lağa qoyurdular. O zaman Cahanşah padşah İraqa yollanmışdı və Məhəmmədi mirzəni çağırmışdı. Ona görə də Məhəmmədi mirzə və Rüstəm Tərxan qalanın ətrafından köçüb Cahanşah padşahın yanına getdilər.

### Cahanşah padşahın İraq tərəfə qoşun çəkməsi və Sultan Məhəmmədlə sülh bağlaması haqqında söhbət

Şahrux padşah Reyin Fəşapuyə [adlı yerində] qışlaq etdiyi vaxt Cahanşah padşah, Əlişəkər bəyi bol töhfələrlə onun aləmin pənahı olan dərgahına göndərmişdi. Adlı-sanlı əmir Sultaniyyəyə çatdıqda Şahrux padşahın vəfatı xəbərini eşidib, həmin şəhəri mühafizə edərək türkman hökmdarının dərgahına bir qasid göndərdi və Sultaniyyənin fəthini ona ərz etdi.

Ona görə də Cahanşah padşah ordu və yaraqla hərəkət bayrağını İraqa doğru qaldırdı və sayı ulduzlardan çox olan bir ordu ilə Qum ətrafında dayandı. O əsnada Mirzə Sultan Məhəmmədin tərəfindən o şəhərin hakimi olan Məlik Şahqazi darvazaları möhkəmləndirib savaş və döyüş qapılarını öz üzünə açdı. Mirzə Sultan Məhəmməd, Əmir İmadəddin Vərzənəni çoxsaylı ordu ilə Şahqazinin köməyinə göndərdi.

O zaman Əmir Hüseyn Taromi adlı-sanlı adamlarla İsfahandan çıxıb türkman hökmdarının xidmətinə gəldi. Mirzə Sultan Məhəmməd [dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin padşahı Şahrux sultanın qaydası ilə bir hökmdar fərmanı qələmə aldı. Məzmunu belə idi: "Padşahın lütfkarlığını görmüş Əmir Cahanşah Türkman bilsin ki, eşitdiyimizə görə, onun adamları hökmdarın fərmanının əksinə olaraq, bizim vilayətimizə daxil olmuşlar. Bu hadisə qanunsuz surətdə beş vermişdir. Gərəkdir ki, o, həmin vilayəti ali divanın naiblərinə geri versin və Şahrux padşahın onun üçün təyin etdiyi məmləkətlə kifayətlənsin. Əks təqdirdə, savaş meydanını təyin etsin!"

[798] Nuruosmaniyyə nüsxəsi: "fahişə qadınlardan biri".

Fərmanın üzərinə möhür vuraraq qasidlə göndərdi. Özü isə qoşunla birlikdə elçinin ardınca yola düşdü.

Cahanşah padşah o fərmanı mütaliə etdikdə və məzmunu ilə tanış olduqda təəccübləndi ki, bu şəxs mənim kimi bir padşaha bu cür fərman yazdığı üçün ya son dərəcə igiddir, ya da tamamilə dəlidir.

Ondan sonra [Cahanşah] müqayisəyəgəlməz bir ordu ilə İraq və Fars tərəfə hərəkətə gəldi. O iki qoşun arasında məsafə yaxınlaşdıqda, Şahrux padşah zamanında Cahanşah padşahı oğulluğa qəbul etmiş Gövhərşad bəyim, Mövlana Yaqub Pərvanəçini elçi kimi Cahanşah padşahın yanına göndərdi. Ona görə də münaqişə və ziddiyyət sülh və uzlaşma ilə əvəzləndi. Yenidən ülfət qaydaları möhkəmləndi. Məhəbbət vasitələri və dostluq əlamətləri əl-ələ verdi. Ədavət və özgəlik yaxınlığa və birliyə çevrildi.

Şeir

"Hər ikisinin ittifaqı ucaltdı tacın və taxtın dəyərini,
Hər ikisinin birliyi işıqlandırdı mülkün və dinin gözünü".

Gövhərşad bəyim o zaman Mirzə Əlaüddövlə, Əmir Şeyx Loğman Barlas və Əhməd Firuzşahla birgə Uluğ bəydən qaçıb Sultan Məhəmmədin ordusuna qoşulmuşdu. Sonra sülh bağlandı[799]. Mirzə Sultan Məhəmməd onun (Cahanşahın) qızını öz nikahına alıb, Qəzvin və Sultaniyyəni süd haqqı (şir-baha) olaraq yüksək məqamlı Cahanşah padşaha verdi. Hər iki ordu qılınclarını və nizələrini işlətmədən öz diyarına qayıtdı. Cahanşah padşah Həmədan hakimliyini Əlişəkər bəyə, Qəzvini Qılıc Aslana, Sultaniyyəni isə Şahsüvar bəy Bayramiyə lütf etdi.

**Mirzə Uluğ bəylə Mirzə Əlaüddövlənin müharibə etməsi haqqında söhbət**

Mirzə Əlaüddövlə, Mirzə Əbdüllətifi həbsdən buraxsa da, onun mülazimlərini həbsdə saxlamışdı və Mirzə Salehi bir dəstə qoşunla Mürğab çayı tərəfə göndərərək Mirzə Əbdüllətifin həbsdə olan mülazimlərini qətlə yetirmişdi. O, həmin qış çoxsaylı ordu ilə Əndixud və Şibirğan tərəfə yola düşüb o şəhərləri dağıtdı və geri qayıdıb Herata gəldi. Öz oğlu Mirzə İbrahim üçün sünnət toyu etdi.

Mirzə Uluğ bəy Kürəkan Əndixud və Şibirğan vilayətlərində baş vermiş dağıntılar səbəbindən səhra qumundan daha artıq sayda bir ordu ilə Ceyhundan keçib Əndixudun on fərsəxliyindəki Qazı kəndində dayandı. Mirzə Əbdüllətif Xüttəlan, Qunduz, Bəğlan, Ərhəng və Saray qoşunlarını ta Bədəxşan, Bəlx, San və Çaharyek hüduduna qədər toplayıb atasının ordusuna qoşuldu.

Mirzə Əlaüddövlə bu xəbəri eşitdikdə, Əmir Məhəmməd Sufi Tərxanı və Əmir Əbu-Səidi Herat hakimliyində və daruğalığında qoyub çoxlu ordu ilə döyüşə və vuruşa yollandı. Sincab keçidindən keçdi. Sülh etməyə meyilləndi. Öz yaxınlarından bir dəstəsini şəhərə göndərdi ki, Mirzə Uluğ bəylə sülh barədə danışmaq üçün Şeyx Bəhaəddin Öməri orduya gətirsinlər. Şeyx onların xahişini qəbul edib orduya yollandı. Mirzə Uluğ bəy şeyxin gəlişindən öncə Mürğabdan keçdi. Heratın on dörd fərsəxliyində yerləşən Tərnabda iki qoşun üz-üzə gəldi. Döyüş səfi qurdular. Mirzə Uluğ bəyin sol cinahı Mirzə Əbdüllətifin iştirakı ilə qüvvətləndi, sağ cinahı Mirzə Əbdüləzizin şövkətinin parlaqlığı ilə möhkəmləndi. Mirzə öz nəfis vücudu ilə döyüşkən dilavərlərlə birlikdə ordunun mərkəzində dayandı.

Mirzə Əlaüddövlə isə Mirzə Salehi sağ cinaha göndərdi, sol cinahı tutmağı Xəlil sultana tapşırdı və özü mərkəzdə qərarlaşdı. O əsnada Mirzə Abdulla ordunun səfini viran qoyub Mirzə Uluğ bəyə qoşuldu. Ona görə də Xorasan ordusu qorxaq-hürkək oldu. Mirzə Əlaüddövlə çox döyüşdükdən sonra idbar üzünü fərar vadisinə tutdu. Gövhərşad bəyim və qardaşı Əmir Məhəmməd Sufi Tərxan Heratı tərk edib Mirzə Sultan Məhəmmədə birləşdilər. Mirzə Uluğ bəy ətrafa və yan-yörəyə fəthnamələr yolladı. Mirzə Əbdüllətif bu vuruşmada şücaət əlamətləri göstərməsinə baxmayaraq, fəthnamədə Mirzə Əbdüləzizin bahadırlığını yazmağı əmr etdi. O səbəbdən divə bənzər şahzadənin könlünə nifaq tozu qondu.

Mirzə Uluğ bəy Herata doğru hərəkətə gəldi. Çeheldoxtəran (Qırx qız) mənzilində onun əsgərləri Şeyx Bəhaəddin Ömərlə rastlaşdılar və onun mallarını qarət etdilər. Mirzə Uluğ bəy onun ulağlarını geri ver-

[799] Bu sülh Cürbadəqanda bağlanmışdı *(Nəvai, şərhlər, s.439).*

di. Nərətu və İxtiyarəddin[800] qalalarının kutvalları xəzinələrin açarlarını təhvil verdilər. Əmir Sultanşah Barlasın oğlu Əmir Cəlaləddin Məhəmməd qeyd edilən hadisənin tarixi barədə belə deyir:

Şeir

"Ölkə tutan müzəffər Uluğ bəy,
Səltənətə gözəl bir təməl qoydu.
Xorasan tərəfə qoşun çəkdi,
Ona fəth müyəssər oldu, qəribə bir fəth.
Ağıl onun qoşununun qələbəsinin ardınca,
"Zəfər yaxındır, şübhəsiz" (852) tarixini söylədi".

Mirzə Əlaüddövlə məğlubiyyətdən sonra Xəbuşan vilayətinə gedib Mirzə Baburla birləşdi. Mirzə Uluğ bəy bu xəbəri eşitdikdə, Mirzə İsgəndər Türkmanın oğlu Yarəlini və Əbu-Səid Daruğanı həbs edib Nərətu qalasına göndərdi. Özü isə Üləngi-Radkana[801] yönəldi. O məqamda Mirzə Baburun elçiləri orduya gəldilər və gətirdikləri töhfələri təqdim etdilər. Mirzə Uluğ bəy onlara hörmət göstərib geri qayıtmağa icazə verdi. Ondan sonra elçilərin ardınca yola düşdü.

Müzəffər hökmdar İsfərayinə[802] gəldikdə Mirzə Əbdüllətifi və Mirzə Abdullanı qaniçən bahadırların bir dəstəsi ilə Bistam[803] tərəfə göndərdi. Mirzə Uluğ bəy İbrişim körpüsünə qədər gedib geri döndü. Dönüşünün səbəbi o idi ki, yanında doxsan min adam vardı və onlar Mirzə Əlaüddövlə ilə savaşda çoxlu qənimət ələ keçirmişdilər. İstəyirdilər ki, həmin malları öz evlərinə çatdırsınlar. Ona görə də dəstə-dəstə qaçıb gedirdilər. Mirzə Əbdüllətif Bistam sərhədində bu xəbəri eşidib yüyənini döndərdi və yol əsnasında xəstələnib müqəddəs Məşhəddə ali məiyyətə qoşuldu.

Mirzə Uluğ bəy, Yarəli ilə Əbu-Səid Daruğanı Nərətu qalasına göndərdiyi vaxt Əbu-Səid Daruğanın tərəfdarları çörəyin arasına bir yeyə qoyub onun yanına göndərdilər. Onlar həmin yeyə vasitəsilə özlərini həbsdən xilas etdilər və qala əhlinə qılınc vurub qalanı ələ keçirdilər. Yarəli Herata doğru hərəkətə gəldi. O şəhərin hakimi Əmir Bayəzid Pərvanəçi küləyə və şimşəyə tay olan bir qasidi Mirzə Uluğ bəyin yanına göndərdi və özü bazar camaatından bir dəstə ilə onu (Yarəlini) qarşılamağa tələsdi. Yarəli onları məğlub etdi, daha sonra şəhərə gələrək döyüşə başladı. On yeddi gün sonra Mirzə Uluğ bəy Herat ətrafına gəldi. Yarəli Türkman məyusluq və məhrumiyyət içində Nərətu qalasına qayıtdı.

Mirzə Uluğ bəy Heratda dayanıb, Əmir Bayəzid Pərvanəçinin təhriki ilə şəhərin ətrafındakı əhalini Yarəli ilə dostluqda ittiham etdi. Onların mallarını qarət etdilər. Həmin günlərdə sərt soyuq vardı. Bir şəxs köynəksiz və şalvarsız olaraq çılpaq halda Uluğ bəyin yanına gedib dedi:

- Ey aqil, adil və fazil padşah! Bayram günündə[804] bizə bayram xoşbəxtliyi vermədin; ömrün və dövlətin çox olsun!

Nadir təsadüflərdən biri odur ki, Mirzə Uluğ bəy Heratı qarət edən zaman özbək ordusu da Səmərqəndə basqın etdi. Onlar Mirzə Uluğ bəyin şəxsi (xassə)[805] bağlarını viran qoydular və divarının aşağı hissəsi Xətaydan gətirilmiş çinidən olan evi çomaq zərbəsi ilə alt-üst etdilər. "Hər hansı bir pisliyin cəzası onun özü kimi bir pislikdir"[806] [ayəsinin] surəti açıq bir şəkildə özünü göstərdi. Mirzə Uluğ bəy Herat hakimliyini Mirzə Əbdüllətifə tapşırıb Şahrux padşahın cəsədini Səmərqəndə yolladı və Gövhərşad bəyim mədrəsəsində olan bir neçə cüt polad qapını özü ilə apardı[807]. Mərv yolundan Səmərqəndə yönəlib, körpü bağlayaraq Amudərya çayından keçdi. Qoşunun bir hissəsi keçmişdi, bir hissəsi isə hələ keçməkdə idi ki, özbək ordusu onlara hü-

[800] Nərətu – Heratın 10 fərsəx şimal-şərqindəki bir dağ başında yerləşirdi. İxtiyarəddin qalası – Heratın şimalında idi *(Nəvai, şərhlər, s.441).*
[801] Məşhəddən Xəbuşana gedən yolun üzərindədir *(Seddon, şərhlər, s.237).*
[802] İsfərayin – İranın şərqində, indiki Bocnurd şəhristanına daxil olan beş nahiyədən biri.
[803] Bistam (Bəstam) – İranın şimal-şərqində, Elburz dağ silsiləsinin yaxınlığında tarixi şəhər. Hal-hazırda İranın Şahrud şəhristanının Püştbəstam nahiyəsinin inzibati mərkəzidir.
[804] "Mətləüs-səədeyn"ə əsasən, həmin gün Orucluq bayramı idi *(Nəvai. Şərhlər, s.442).*
[805] Xassə ("xasseyi-şərifə") şaha və şah ailəsinə məxsus mülkiyyətə, "sərkari-xasseyi-şərifə" isə həmin mülkiyyətə nəzarəti həyata keçirən müdriyyətə deyilirdi.
[806] *Qurani-Kərim, "Şura" surəsi, 40-cı ayə.*
[807] "Mətləüs-səədeyn"ə görə, həmin qapıları Şahrux Təbrizdən gətirmişdi *(Nəvai, şərhlər, s.443).*

cum edib bir dəstəsini əsir aldı. Mirzə Uluğ bəy Buxarada qışlaq edib Şahrux padşahın cəsədini Səmərqəndə yolladı.

Mirzə Uluğ bəyin geri döndüyünü eşidən Mirzə Babur izdihamlı ordu ilə onun ardınca sürətli yürüş etdi. Əmir Hindukəni bir dəstə igidlə Mərv tərəfə yolladı ki, oraya əl uzatsınlar. Əmir Hindukə, Mirzə Uluğ bəyin ordusunun həndəvərinə çatdı, Əmir İbrahim İdigü Təməri əsir aldı və Herata getdi. Üç gündən sonra Yarəli Türkman Herata çatdı. Baburun əmirləri İxtiyarəddin qalasına pənah apardılar və oradan da gecə fərar etdilər.

Yarəli son dərəcə ağılsızlıq və biliksizliyindən şərab içməklə məşğul olub heç kimi qaravulda dayanmağa göndərmədi. O əsnada Mirzə Baburun ordusundan Əbdüləli Rikabdar məkr və hiylə üzündən Yarəlinin yanına gəlib ona nədimlik və xidmətkarlıq etmək yolunu tutdu. Hökmdarın bayraqları yaxına çatdıqları gecə Əbdüləli bundan xəbərdar idi. O, həmin sadəlövh türklərə dolu qədəhlər süzməyə başladı. Ta sübhə qədər şərab içdilər. Mirzə Baburun ordusunun bir dəstəsi Məlik darvazasından şəhər bağına gəldi. Yarəlini sərxoş halda ələ keçirdilər və onu Xiyaban küçəsinin başında Mirzə Baburun ayağını öpmək üçün aparıb qətlə yetirdilər. Mirzə Babur Herat şəhərində yerləşdi.

### Müxtəlif əhvalatlar

Bu il Ədirnədə yeniçərilər hücum edib şəhəri qarət etdilər və Xadim paşanı öldürməyə qəsd etdilər. Xadim paşa özünü Sultan Məhəmmədin evinə salıb xilas oldu və yeniçərilərin ülufəsini artırmaqla fitnə-fəsadı sakitləşdirdi.

Həmçinin bu il Xəlil paşa bir sıra vəzirlərlə ittifaq edib Sultan Muradı səltənətə əyləşdirdi və Sultan Məhəmmədi Manisaya yolladılar. Sultan Murad da həmin qış Moraya[808] yola düşdü.

## 852-Cİ İLİN (07.03.1448 – 23.02.1449) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### Sultan Muradın Firəng padşahı Yanko ilə müharibəsi

Bu il Rum padşahı Sultan Murad çoxlu ordu və aslan ovlayan igidlərlə hərəkət bayrağını Arnavut vilayəti tərəfə yüksəltdi. Qocacuq qalasını[809] digər iki qala ilə birlikdə ələ keçirdi. O diyarın hakimi xain İsgəndər bəla əlamətli qoşunların gəlişindən agah olub, qılınc və nizə işlətmədən Firəngistan tərəfə qaçdı. Rum əsgərləri həmin hüdudu və ölkəni talan edib onların kilsələrini viran qoydular. O əsnada Engirüs kralı olmuş Yanko Macar, Alman, Latın, Əflaq və Engirüs ordusunu toplayıb, savaş tozunu qaldırmaq əzmi ilə Belqrad vilayətindən keçərək döyüş və vuruş meydanına yönəldi.

Sultan Murad bu xəbəri eşidən zaman səbirsiz halda Ədirnə diyarından Sofiya vilayətinə gəldi. Anadolu və Rumeli ordularını toplamaq üçün qasidlər göndərdi. Qısa zamanda çoxlu qoşun və saysız güruh, on min əzəb[810] və yeniçəri xeyli top-tüfənglə ali mənşəli padşahın bayraqlarının kölgəsində cəmləşdilər.

Beyt

“Zöhhak[811] kimi qüvvətli və ayıq-sayıq igidlər,
Hər tərəfdən ilanlar kimi tüfənglər çiyinlərində”.

Sultan Murad öz oğlu Sultan Məhəmmədlə birlikdə kafirlər ordusunu qarşıladı. Kafirlərin qoşunları Nigboluya çatdılar. O diyarın hakimi Məhəmməd bəy onların arxasından gəlib bir dəstəsini qətlə yetirdi. Sultan Murad altmış min nəfər yaxşı silahlanmış süvari ilə kafirlərin ardınca sürətli yürüş etdi. Müzəffər bayraqlı hökmdar Kosovada Firəng qoşununa çatdı. Hər iki tərəf səflərini qurmaqla məşğul oldu. Kafirlər qoşunu dəstə-dəstə bir dağdan digər dağa qədər mövqe tutmuşdu. Şövkətli igidlər dəmirə və polada qərq olmuş halda dayanaraq qılınclarını sıyırmış və bayraqları yüksəltmişdilər.

Nəzm

---

[808] Mora – Yunanıstanın cənubunda yarımada.
[809] Qocacuq (Qocacıq) qalası Makedoniyanın qərbində yerləşir. Digər adı Svetiqrad qalasıdır.
[810] Əzəb – Osmanlı ordusunun kəndlilərdən toplanan qeyri-nizami piyada qoşunu.
[811] Zöhhak – qədim İran mifologiyasında Hind-İran ortaq ənənəsindən qalma insan vücudlu əjdaha və ya əjdaha görkəmli insan obrazı *(K.Demirci, M.Uzun. Dahhâk // TDVİA, cilt: 8, yıl: 1993, s.408-409).*

“Bayrağın ucundakı ay fələyə cilvə edir,
Fitnə qapısını asimana açmış.
Qalxdı tunc təbiətli neyin nəfəsi,
Və ondan kəhkəşan sovruldu saman kimi küləyə.
O meydanda hay-küyün və gurultunun çoxluğundan,
Göydəki ay qulağına pambıq tıxadı.
Pələng dərisi geyənlər böyük əzəmətə malikdilər,
Onlar dağ kimi idilər, lakin bellərində kin qılıncı vardı”.

O iki qoşun hər iki tərəfdən şeypur çalıb bir-birinə çoxlu top-tüfəng atdılar. Ox, xəlvət guşəsində oturan zahidlərin duaları kimi kaman çilləxanasından uğur qanadını açıb kinlə dolu sinələri özünün ciyər deşən ucu ilə dəlirdi. Nizə, həqiqəti görənlərin fikirləri kimi sərrast şəkildə böyürlərə dəyirdi. Onun dilindən düşən hər şey ürəklərə təsir edirdi. Ölüm ahəngli tüfəng gülləsi savaş meşəsi aslanlarının bədənini ələk kimi deşik-deşik edirdi.

Şeir

“Tüfəng buludundan o döyüş meydanında,
Göy gurultusu və şimşəklə doldu asiman və zəmin.
Tüfəng pəhləvanların ürək bağının qönçəsi oldu,
Və o qönçədən hasil oldu dərhal ürək yarası.
Bəla oxu döyüş kamanında,
Oturmuş əcəl ölüm pusqusunda.
Zirehlər oxların ucbatından qanla doldu,
Tüfəngin tüstüsündən hamı ağlar oldu”.

Xəncər vuran günəş o döyüşün qorxusundan məğribin gizli evinə doğru hərəkət bayrağı açdıqdan sonra o iki qoşun bir-birinin qarşısında yerləşdilər və gecə hər iki tərəf gözətçilik etməklə məşğul oldu.

Beyt

“İki qoşun döyüşdən mənzilə getdi,
Bir qismi xəcalətlə, bir qismi söhbətlə zaman keçirdi”.

Ertəsi gün fələyin aslan süvarisi (günəş) ləl üzlü qılıncını çəkdi, civə qalxanı zərnigar səmanın üzündən götürdü, zərli çətiri civəli üfüqdən çıxardı və zərli nizə ilə fələk meydanından ayın gümüşü [rəngli] hoqqasını qovdu.

Nəzm

“Sübh çağı bu döyüş meydanının şahı,
Çəkdi üfüqün belindən iti qılıncı.
Aləmin qanını tökməyə kəmər bağladı günəş,
Parlatdı kin atəşi ilə çöhrəsini.
Ulduzlar ordusunun damarını çıxardı,
Kösövdən qaçdılar o qığılcımlar”.

Yenidən hər iki tərəfdən qoşunlar coşdular və hay-küy saldılar.

Beyt

“Asimandan keçdi bu coşqu və hay-küy,
Fələk ayı pambıq kimi qulağına taxdı”.

Müsəlləh və mükəmməl olub bir-birinin qarşısında hərbi səflər çəkdilər. Lənətəgəlmiş Yanko hiddət və kin üzündən Sultan Muradın sağ cinahına həmlə etdi. Mina rəngli qılınc ad-san sahiblərinin qanından qırmızı yaqut rəngini aldı. Digər Firəng dilavərləri də igidlik və mərdlik zərurətlərini yerinə yetirdilər. Sultan Muradın adamları öz əhval səhifələri üzərində uğursuzluq əlamətləri müşahidə etdikdə fərar vadisinə üz qoydular. Kafirlərin qoşunları atəş saçan qılınc zərbəsi ilə bir çoxlarını qətlə yetirdilər.

Amma Sultan Murad qətiyyət və mətanət ayağını möhkəm saxladı. Yeniçərilər və əzəblər onun başına qalxanlarını tutdular və idbar əhlinin üzərinə bir anda çoxlu top-tüfəng yağdırdılar.

Şeir

“Döyüş meydanındakı tüfənglərdən,
Bu mavi qübbəyə (asimana) səda düşdü.
Tüstüdən o meydanda ürək partlayırdı,
Fələk ürək tüstüsü ilə dolu manqala döndü”.

Firəng dilavərləri bir neçə həmlə etsələr də, o ordunun mərkəzini yerindən dəbərdə bilmədilər. Kafirlərin qoşunlarının bir dəstəsi onları (qaçan Osmanlı əsgərlərini) təqib edirdi. Rum qoşunun bir dəstəsi onların arxasından gəlib kafirlərin qoşununa qılınc vurdular. Fərar etmiş Anadolu və Rumeli orduları qayıdıb idbar əhlinə həmlə etdilər.

Nəzm

“Çəkdilər ordu önündə yenidən səf,
Bir yerə toplandılar hər tərəfdən.
Güclü düşmən qoşununun əndişəsindən,
Onların pərakəndə barmaqları bir yumruq oldu”.

Yanko öz tale səhifəsi üzərində acizlik və çarəsizlik əlamətlərini müşahidə etdikdə bildi ki, fəth və qələbə qoşunun çoxluğunda deyil, bəlkə də, qəzavü-qədərin təqdirindədir. O, arabaların arasına girib fərar vadisinə üz qoydu. Bəzi adamlar can qorxusundan çöl tərəfə qaçdılar və özlərini bir kəndə saldılar. Rumilər od vurub o kəndin hamısını yandırdılar. Rum ordusunun digər hissəsi arabaları araya alıb qırğına başladılar. Yanko firənglərə dedi ki, “mən düşməni qıran ordu ilə arabalar arasından çıxaram və Rum ordusunun arxasına keçib onları məğlub edərəm”. O, bu hiylə ilə onların arasından çıxıb fərar etdi. Ordunun qalanı sübhəcən savaşdı. Yankonun qaçdığı məlum olduqda onların hamısı pərən-pərən düşdü. Yaramazların ordusundan bir çoxları döyüş meydanında əlsiz-ayaqsız düşüb qalmışdı. Qara Mixal bir neçə mötəbər əmirlə birlikdə əsir alındı. İzdihamlı ordunun əlinə çoxlu qənimət düşdü. Sultan Murad onların cəsədlərinə tamaşa etdi. Sonra Sultan Murad, Əzəb bəyə dedi ki, “öldürülənlər arasında bir ağsaqqal belə yoxdur”. O, ərz etdi ki, “əgər onların arasında bir ağsaqqal olsaydı, bu hala düşməzdilər”.

Yanko qaçış zamanı Lasoğluya yetişmiş, o da onu Semendireyə aparmışdı. Paşalar ərz etdilər ki, “onu tələb edək”. Sultan Murad dedi: “Kaş ki, onun kimi bir kafir olaydı, üstümüzə gələydi və biz də onunla savaşaydıq”. Ondan sonra Sultan Murad Ədirnəyə döndü və orada qışlaq etdi.

## 853-CÜ İLDƏ (24.02.1449 – 13.02.1450) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA

Bu il Mirzə Babur Tun[812] hakimliyini Mirzə Ədaüddövləyə həvalə etdi. O cənab öz oğlu Mirzə İbrahimi o səmtə göndərdi. Bir neçə gün sonra Mirzə Babur bir sıra adamların təhriki ilə Mirzə Əlaüddövləni məhbus etdi və Tuna bir dəstə göndərdi ki, Mirzə İbrahimi də tutub gətirsinlər. Əmir Əhməd Yasavul böyük bir döyüş etdi. Onun əli ağır yaralandı. Axırda Mirzə İbrahimi də tutub Mirzə Baburun yanına gətirdilər. Mirzə İbrahimlə birlikdə gətirdikləri cavahirat və qızıl sandıqlarını açmadan və çəkisini ölçmədən [onlara] bağışladı. Bütün o pullar və cavahirat onun comərdlik mizanında bir arpa dəyərində olmadı.

O əsnada Mirzə Əbdüllətif Bəlxdən elçi göndərib xəbər verdi ki, “Mirzə Uluğ bəy hədsiz-hüdudsuz bir ordu toplayıb və Xorasana gəlmək istəyir; biz onun yolunun üstünü tutmuşuq və sizinlə ittifaq məqamındayıq”. Mirzə Babur elçiyə hörmət göstərib münasib cavab göndərdi.

O zaman Mirzə Babur eşitdi ki, Sistan hakimi Şah Hüseyn xilaf düşüncəyə qapılmışdır və müxaliflik vadisində cövlan etməkdədir. Ona görə də çoxsaylı ordu ilə həmin tərəfə yola düşdü. İsfizar[813] qəsəbəsi ali mənşəli padşahın dayanacaq yeri olduqda, əmirləri mənqəlay təyin edib qabaqcadan göndərdi. Şah Hüseyn bildi ki, müzəffər orduya qarşı müqavimət onun qüdrəti daxilində deyildir. O, bac-xərac [ödəməyi] qəbul etdi. Mirzə Babur onun təqsirlər dəftəri üzərinə əfv qələmi çəkib Herata yönəldi.

Bu əhvalat baş verdiyi zaman Əmir Hindukə müxaliflik bayrağını qaldırıb Əmir İbrahimi[814] Səmərqəndə göndərdi və öz hərəkət yüyənini Astarabad tərəfə döndərdi. Mirzə Babur xəbər tutduqda Şeyx Əli Bahadırı bütün ordu ilə onu dəf etməyə yolladı. Onlar Xəbuşan vilayətində ona yetişdilər. Ağır bir döyüş baş

---

[812] Tun – İranın şərqində, Cünabəd şəhərindən cənub-qərb tərəfdə yerləşən şəhər.
[813] İsfizar – indiki Əfqanıstanda, Heratdan cənubda yerləşən Şindand şəhərinin köhnə adı.
[814] İdigü Teymurun oğlu Əmir İbrahim *(Nəvai, şərhlər, s.453).*

verdi. Əvvəlcə Əmir Hindukənin ordusu qalib gəlib qarətlə məşğul oldu. Şeyx Əli Bahadır qəflətən Əmir Hindukəni qətlə yetirməklə öz adını və babası Şeyx Əli Bahadırın adını yaşatdı və onun başını Mirzə Babura göndərdi.

Həmçinin bu il İmad qalası fəth edildi. Onun şərhi belədir ki, Məhəmməd Saleh adlı bir cavanı Mirzə Əlaüddövlə cüzi miqdarda nağd [pul] gətirmək üçün İmad qalasına göndərmişdi. O, qalaya getdi və qala kutvalı ilə dostlaşdı. Hər birində doqquz libas olan bir neçə dəst paltar və bir neçə səbət meyvə hazırlatdırıb öz mülazimlərinə buyurdu ki, qalaya daxil olsunlar. Özü isə kutvalla şərab içməklə məşğul oldu.

Sonra onun mülazimləri qılınclarını çəkib Mirzə Baburun adına salavat verdilər, bir neçə adamı qətlə yetirdilər və fəth xəbərini Mirzə Babura yetişdirdilər. O əsnada Mirzə Əlaüddövlənin mühafizləri qafil qaldılar. Özü isə fərar edib Qur yolundan Sistana yönəldi. Mirzə Babur onu dəf etmək üçün Əmir Xudadadı çoxsaylı bir dəstə ilə göndərdi. Mirzə Əlaüddövlə, Mirzə Baburun qoşunlarının gəlişindən xəbər tutduqda, İraq tərəfə tələsdi və Yəzd sərhədinə getdi. O, özünün gəlişi haqqında Mirzə Sultan Məhəmmədə xəbər göndərdi. Lakin onun namehriban qardaşı rədd əlini onun ümid sinəsi üzərinə qoyub xəbər verdi ki, "ali bayraqlarımız Xorasana doğru hərəkətdədir; qardaşım Yəzd çölündə qalsın ki, hərəkət vaxtı bizə qoşulsun". Bu səbəbdən Mirzə Əlaüddövlə bir neçə gün orada qaldı.

### Mirzə Sultan Məhəmmədin qoşun çəkməsi və Mirzə Baburla müharibə etməsi haqqında söhbət

Bu il Mirzə Sultan Məhəmməd sayı yağış qədər olan ordu ilə İraqdan hərəkət bayrağını Xorasan tərəfə qaldırdı. O tərəfdən Mirzə Babur cəsarətli qoşunlarla onu qarşılamağa tələsdi. Cam vilayətində[815] iki qoşun üzləşdi. O iki ordunun dəstələri dənizin ləpələri kimi bir-birinə qarışdılar və döyüş meydanı mərd igidlərdən və savaş günü bahadırlarından məhşər çölünə döndü. Su rəngindəki qılınc torpağı və daşı qırmızı yaqut rənginə boyadı. Meydanın torpağı bahadırların qanı ilə yoğruldu.

Nəzm

"Qana qərq oldu torpaq, daş və ot,
Əgər [orada] bir dəyirman olsaydı, qanla dönərdi.
Çöl dəqiq surətdə bir qan dənizinə döndü,
Sanki yer üzündə lalə bitdi".

Çoxlu çalış-vuruşdan sonra İraq ordusu Xorasan qoşununu məğlub etdi. Mirzə Babur özünü İmad qalasına saldı. Mirzə Sultan Məhəmməd Herata yönəldi. İlk öncə Əmir Pirzad Buxarini Herat rəiyyətinin könlünü almaq üçün göndərdi. Bir neçə gün sonra isə Şahrux padşahın taxtgahına getdi. Mirzə İbrahim sultanı həbsdən buraxıb, özü ilə birlikdə gəlmiş Mirzə Əlaüddövlənin yanına yolladı.

O zaman Mirzə Əbdüllətifin tərəfindən elçi gəldi və məktub gətirdi. Məzmunu belə idi: "Sizin Xorasanı, bizim də Mavəraünnəhri fəth etməyimiz mübarək olsun! Mirzə Baburla ona görə dostluq edirdik ki, sizin qardaşınızdır. Yoxsa hamı bilir ki, Şahrux padşah zamanında o kim idi, biz kim idik".

Mirzə Sultan Məhəmməd az töhfə gətirmiş elçiyə külli məbləğ verib yola saldı.

### Mirzə Əbdüllətifin Mirzə Uluğ bəyə qarşı üsyan etməsi haqqında

Mirzə Əbdüllətif Heratdan Bəlxə gəldiyi zaman Mirzə Uluğ bəy o şəhərin idarəçiliyini ona tapşırdı. Barlas və tərxan [tayfalarının] əmirlərindən [ibarət] bir dəstə adam onu atasına qarşı çıxmağa təhrik etdilər. Ona görə də xilaf qılıncını qılafdan çəkib üsyan və tüğyan bayrağını qaldırdı və atasının hökmü ilə onun mülazimi olan Əmir Mənsurla Sultan Məliki qətlə yetirdi. O, mükəmməl elmi və son dərəcə ədalətli sayəsində əsrin yeganəsi olan atasına itaət göstərməyib özünü dostun və düşmənin tənə oxuna nişan etdi və aləmin söyüş və lənət dilinin özünə doğru uzanmasına səbəb oldu.

Nəzm

"Şəriətə görə, yaraşmaz bir oğlana,
Bilikli bir sultan olan atasından üz çevirmək.
Sənin atan padşah olarsa,

---

[815] Camın Fərhadcərd kəndi yaxınlığında *(Nəvai, şərhlər, s.454).*

Fəzilətli və ədalətli bir şəxsdirsə o,
Gərək onun fərmanından boyun qaçırmayasan,
Onun dərgahının önünə və qapısna başını qoyasan".

Sonra tamğa[816] sandığını sındırdı və elan etdi ki, tamğanı aradan qaldırdıq. Bu xəbər Mirzə Uluğ bəyə çatdıqda, Mirzə Əbdüləzizi Səmərqənddə qoyub fələyin hadisələri və səhranın qumu qədər çox olan bir ordu ilə Ceyhun sahilinə gəldi. Mirzə Əbdüllətif onun çayı keçməsinə mane oldu. Bir neçə dəfə iki qoşun çayı keçib bir-biri ilə döyüşdü və əksər toqquşmalarda Mirzə Əbdüllətifin ordusu zəfər qazandı.

Bir gün Mirzə Uluğ bəy, Mirzə Abdullanı çaydan keçirdi. Mirzə Əbdüllətif onu ələ keçirib aman verdi. Bir neçə gün sonra Səmərqənddən xəbər gəldi ki, Mirzə Əbdüləziz əmirlərin əhlü-əyalına (ailələrinə və arvadlarına) əl uzatmışdır. Əmirlər özlərindən çıxdılar və az qaldı ki, Mirzə Uluğ bəyi tutub Mirzə Əbdüllətifə təslim etsinlər. Bu əsnada elə bir hadisə üz verdi ki, heç kimin xəyal aynası onu təsəvvür etmirdi. Onun təfsilatı belədir ki, həmişə Mirzə Uluğ bəyin xidmətində olmuş Mirzə Sultan Əbu-Səid ibn Mirzə Sultan Məhəmməd ibn Mirzə Miranşah ibn Əmir Teymur ata ilə oğlun bir-biri ilə qarşı-qarşıya durduğu bu məqamda fürsəti qənimət bilib, ərğun elini özünə müttəfiq edərək Səmərqənd tərəfə hərəkət bayrağını yüksəltdi. Mirzə Əbdüləziz müqavimət göstərməyə taqəti olmadığı üçün quyruğunu qısıb qalaya sığındı.

Bu möhnətli xəbər Mirzə Uluğ bəyə çatdıqda hərəkət yüyənini Səmərqəndə sarı döndərdi. Sultan Əbu-Səid, Mirzə Uluğ bəyin gəlişi xəbərini eşitdikdə, Səmərqənd ətrafından köç edib ərğun elinin arasına getdi. Mirzə Əbdüllətif Amudərya çayından keçib Şəhri-Səbzdə (Yaşıl şəhərdə)[817] dayandı. Bir neçə gündən sonra o, aləmi yandıran qoşunlarla Səmərqəndə yollandı. Mirzə Uluğ bəy də fitnə salan dilavərlərlə onu qarşılamağa tələsdi. Dəməşq kəndində[818] ağır bir savaş oldu. Səmərqəndilərin vəziyyətinə süstlük üz vermədən onlar təpə tərəfdən çıxıb fərar vadisinə üz tutdular. Əmir Hacı Məhəmməd Xosrov, Mirzə Uluğ bəyə dedi:

- Əgər təpənin bu tərəfinə ensəydin, Mirzə Əbdüllətifin qoşununun hamısı qaçardı.

Buyurdu:

- Ey Hacım! Əcəb söz deyirsən! Enişin-yoxuşun sahibi bizi təpədən endirmişdir.

Mirzə Uluğ bəy məğlub olaraq Səmərqəndə yollandı. Onun tabeçilərindən olan Miranşah Quçin rədd əlini onun ümid sinəsi üzərinə qoydu. Mirzə Uluğ bəy öz oğlu Mirzə Əbdüləzizlə Şahruxiyyə[819] tərəfə yola düşdü.

Qala kutvalı İbrahim ona qəsd etdiyi üçün Şahruxiyyədən geri dönüb Səmərqəndə gəldi. Orada oğlu ilə görüşdü və iki tərəf arasında qəribə bir əhvalat keçdi[820]. Axırda Mirzə Əbdüllətif, Mirzə Uluğ bəyin fərmanı ilə atası öldürülmüş Abbas adlı birisini təhrik etdi ki, o, həmin zaman seçilmiş xanın[821] önündə diz çökərək qisas alınmasını istəsin. Xan dilə gəldi ki, "şərəfli şəriətin hökmünə əməl edilsin!". Əksər Səmərqənd üləması fitva verdi ki, Mirzə Uluğ bəydən qisas alınması vacibdir. Mirzə Əbdüllətif o cənabı Əmir Hacı Məhəmməd Xosrova tapşırdı ki, Hicaz[822] səfəri ehramını geysin və fani mülkün qaniçən çölündən İlahi cahana üz tutsun.

Əmir Hacıdan nəql olunur ki, axşam vaxtı Mirzə Uluğ bəyin üzəngisinin həndəvərində Səmərqənddən çıxdıq. O həzrət olduqca sevinc və fərəhlə at sürürdü və mənimlə hər cür söhbət edirdi. Bir az məsafə qət etdikdən sonra qəflətən arxadan bir şəxs mənim əlimi çəkdi. O, sulduz qövmündən olan birisiydi. Dedim nə, "nə xəbərdir?". Dedi: "Xanın hökmü belədir ki, Uluğ bəyi abadanlıq olan bir yerdə endirin ki, onun ehtiyacları orada təmin olunsun". Mirzə soruşdu ki, "nə deyir?". Vəziyyəti ona söylədim. Ona görə də dili söhbətdən qaldı və kiçik bir kənddə endi. Hava bir az soyuq olduğu üçün mənə buyurdu ki, od qalayıb kabab edim.

[816] Tamğa – sənətkarlıq və ticarət müəssisələrindən toplanan və yollarda gömrük haqqı olaraq alınan vergi idi. Bu vergini yığanlara tamğaçı deyilirdi *(А.А.Ализаде. Социально-экономическая и политическая история, с.216-223).*

[817] Şəhri-Səbz – Səmərqənddən cənubda, Özbəkistanın Qaşqadərya vilayətində şəhər.

[818] Səmərqənddən yarım mənzil kənarda yerləşən bu kənd Əmir Teymur tərəfindən salınmışdı *(Nəvai, şərhlər, s.456).*

[819] Şahruxiyyə – Əmir Teymurun öz oğlu Şahruxun şərəfinə 794 / 1391-92-ci ildə əsasını qoyduğu şəhər *(Seddon, şərhlər, s.282).* Xarabalıqları Özbəkistanda, Daşkənddən 80 km. cənub-qərbdə, Sırdərya çayının sağ sahilindədir.

[820] Bu söhbət zamanı Əbdüllətif öz atasına xoşagəlməz sözlər söylədi *(Nəvai, şərhlər, s.456-457).*

[821] Həmin zaman Əbdüllətif, Əmir Teymurun etdiyi kimi hərəkət edərək, Çingiz xan soyundan gələn birisini xan taxtına əyləşdirmişdi *(Nəvai, şərhlər, s.457).*

[822] Hicaz – Ərəbistan yarımadasının qərb hissəsində tarixi vilayət. Müqəddəs Kəbənin yerləşdiyi Məkkə şəhəri də Hicaza daxildir. Mirzə Əbdüllətif, atasını Həcc ziyarətinə göndərmək adı ilə yolda öldürmək istəyirdi.

Sonra bəzi nökərlər o işlə məşğul oldular. Qəflətən o atəşdən bir qığılcım onun çiynində olan cübbəyə yetişdi. Cübbə yavaş-yavaş yanmağa başladı. Mirzə öz əli ilə atəşi söndürdü. Çoxlu iztirab edib Mirzə Əbdüləzizin halı barədə soruşdu. Elə bu dəm Abbas və başqa bir şəxs içəri gəldilər. Mirzənin gözü Abbasa düşdükdə yerindən durdu və Abbasın sinəsinə bir neçə yumruq vurdu. Abbasın yoldaşı olan şəxs mirzənin kürkünü çiynindən götürdü. Abbas daxmadan çıxdı ki, kəndir gətirsin. Əmir Hacı Məhəmməd Xosrov evin qapısını möhkəmlətdi ki, mirzə qüsl[823] alsın. Abbas geri döndü və mirzəni bayıra çıxardı. Məşəlin yaxınlığında bir qılınc zərbəsi ilə onu qətlə yetirdi. Mirzə Əbdüllətif bu hadisədən üç gün öncə öz qardaşı Mirzə Əbdüləzizi öldürmüşdü. Fazillərdən biri bu qitəni Mirzə Uluğ bəyin ölümü barədə nəzmə çəkmişdir:

Şeir

Uluğ bəy, o Cəmşid kimi iqtidarlı şah,
Hansı ki, peyğəmbərin dini ondan alırdı güc.
Abbasdan şəhidlik şərbətini içdi,
[Ölüm] tarixinin ili oldu "Abbas öldürdü"[824].

Xülasə, aqibətsiz Mirzə Əbdüllətif barlas və tərxan əmirlərindən Əmir Mahmud Yantuq, Sultan Cüneyd, Sultan Yusif və Əmir İsmayıl Sufi Tərxan kimi bir sıra şəxsləri qətlə yetirdi. Çünki onlar Səmərqəndin fəthi günündə Əmir Sultanşah Barlası və onun oğlu Əmir Cəlaləddini qətlə yetirmişdilər. Sultan Əbu-Səidi də ərğun elindən çağırıb məhbus etdi.

## Ölümlər

Mirzə Uluğ bəy ibn Şahrux padşah ibn Sahibqiran Əmir Teymur Kürəkan. Mirzə Uluğ bəy fəzilətdə, ədalətdə və səxavətdə misilsiz və bənzərsiz idi. Həmişə fəzilət və kamal əhlini himayə etməyə səy göstərirdi. İslamda onun kimi hikmətli, ədalətli və fəzilətli bir padşah olmamışdır. Güclü hafizəsi vardı. Nəql edirlər ki, o, uçurtduğu hər şahinin ovladığı hər ovun tarixini, hansı vaxtda baş verdiyini yazardı və onun üçün bir dəftər tutmuşdu. Bir gün o dəftər itdi. Kitabdar mirzənin yanına gəlib bu barədə məlumat verdi. Mirzə buyurdu:

- Qəm yemə! Çünki dəftərdə yazılanların hamısını yadımda saxlamışam.

Sonra onları bir-bir söylədi və başqa bir dəftərə yazdılar. Bir müddət sonra ilk nüsxə tapıldı. Müqayisə etdikdə gördülər ki, beş yerdən savayı, hamısı düz gəlir. Ədaləti o dərəcədə idi ki, dörd xərvar məhsulun hasil edildiyi torpaqdan dörd dang mis[825] [məbləğində] mal və xərac alardı.

Onun yadigarları arasında Səmərqənddə bir mədrəsə vardır. Oraya çoxlu vəqf bağışlamışdı və yüz elm tələbəsini orada vəzifələndirmişdi. Digəri Səmərqənd yaxınlığında tikdirdiyi bir rəsədxanadır. Orada zic tərtib etmişdir. Mövlana Qiyasəddin Məhəmməd, Qazızadə Rumi və Molla Əli Quşçu bu barədə ona yardım etmişlər.

Örtülü qalmasın ki, ilk dəfə zic kitabını Həkim Tahmufuros[826] tərtib etmişdir. Ondan sonra Həkim Eberxesin[827] zicidir ki, 701-ci ildə tamamlanmışdır. Bəxtünnəsrin[828] zici İsgəndəri [təqvimlə] 600-cü ilə aiddir[829]. Ondan sonra Həkim Menelausun[830] zicidir ki, ondan 244 il sonra, İsgəndəri [təqvimlə] 410-cu ildə [tərtib] etmişdir. "Kitabi-Mecesti"ni Həkim Batlimius[831] 41 il sonra, İsgəndəri [təqvimlə] 451-ci ildə Şapur Züləktaf[832] zamanında hazırlamışdır. İslam padşahları zamanında yazılmış ziclərdən biri Əbu-Məşər Bəlxi-

---

[823] Qüsl – islam dininə görə, insan bədəninin yuyulub təmizlənməsi qaydasıdır.
[824] "Abbas koşt" = 853 h.
[825] Bir dang mis – mis dirhəmin altıda bir hissəsidir. Dörd dang isə mis dirhəmin üçdə iki hissəsidir.
[826] Bu adı dəqiq oxumaq mümkün olmadı. Çox güman ki, bu, yunan riyaziyyatçısı Timoxarisdir. O, öz zamanında ulduzları tədqiq etmiş və Ptolomey özünün "Almageste" kitabında Timoxarisin onun zamanından 410 il öncə yaşadığını göstərmişdir *(Nəvai, şərhlər, s.459)*.
[827] Yunan riyaziyyatçısı Hippark (m.ö. 195-125) nəzərdə tutulur *(Nəvai, şərhlər, s.459)*.
[828] M.ö. 604-562-ci illərdə Babil hökmdarı olmuşdur *(Öztürk, şərhlər, s.290)*.
[829] İsgəndəri təqvim – m. ö. 25-ci ildən etibarən Misirdə tətbiq edilməyə başlanan təqvim. Burada qədim dövrə aid tarixlərin verilməsinə yanlışlıqların və xronoloji uyğunsuzluqların olduğu hiss edilir.
[830] Miladi təqmivin I əsrinin sonlarında fəaliyyət göstərmiş isgəndəriyyəli alim *(Nəvai, şərhlər, s.459)*.
[831] Klaudi Ptolomey (miladi 90-168) – yunan astronomu və coğrafiyaçısı. Ən məşhur əsəri "Almageste" sayılır. Müsəlman alimləri bu əsəri "əl-Mecesti" adlandırırdılar *(Nəvai, şərhlər, s.459)*.
[832] Sasani şahı II Şapur (309-379).

nin[833] zicidir ki, Harun ər-Rəşid[834] zamanında tərtib edilmişdir. Digəri "Zici-Məmuni"dir ki, "Mecesti"dən 671 il sonra, hicri 215-ci ildə (28.02.830 – 17.02.831) tamamlanmışdır[835]. Başqa bir zici Həkim Məhəmməd ibn Cabir[836], Xalid Mərvəzi[837], Əxtəri Məssah, Həkim Üstürlabi[838] və digərləri birlikdə tərtib etmişlər. "Surət-tül-kəvakib" ("Ulduzların surətləri") kitabını "Zici-Məmuni"dən 114 il sonra Əbülhəsən Sufi kimi tanınan Həkim Əbdürrəhman[839], Əzüdüddövlə Deyləmi üçün hazırlamışdır. Ondan sonra Misir hakimi əl-Hakim Bil-lah İsmaili üçün düzəldilmiş zic gəlir[840]. Ondan sonra Həkim Əbu-Reyhan Məhəmməd ibn Əhməd ibn Harun əl-Xarəzminin Sultan Məsud ibn Mahmud Qəznəvi üçün tərtib etdiyi zicdir[841]. Ondan sonra Həkim Hüsaməddin Salar, Həkim Ənvəri və Zahid Əbdürrəhman Xazini birlikdə [zic] düzəltmişlər[842]. Ondan 27 il sonra "Zici-əlayi" tamamlanmışdır[843]. Digər bir zici də Həkim Fəridəddin Əbül-Həsən Əli ibn Əbdülkərim Bakuyi[844] tərtib etmişdir. Digəri "Zici-xani"dir ki, mütəfəkkirlərin ən görkəmlisi, alimlərin ən fəzilətlisi, yer üzü sakinlərinin seçkini, hökmdarların və sultanların nəsihətçisi, göndərilmiş peyğəmbərlərin varisi, keçmiş və sonrakı alimlərin ən kamili, bəşəriyyətin ustadı, on birinci ağıl Xoca Nəsirülhəqq Vəddünya Vəddin (Nəsirəddin) Məhəmməd ibn Həsən Tusi[845], Hülaku xanın və Abaqa xanın fərmanı ilə Müəyyəddin Ərzi, Fəxrədin Marağı, Fəxrəddin Əxlati və Nəcməddin Dəbiran Qəzvini ilə birlikdə hicri 663-cü ildə (24.10.1264 – 12.10.1265) tərtib etmişdir. Ondan sonra "Zicül-ənvar"dır ki, elə həmin zamanda Həkim Möhyəddin Məğribi tərəfindən hazırlanmışdır və "Zici-xani"də olan azacıq müşkülləri həll etmişdir[846].

## 854-CÜ İLDƏ (14.02.1450 – 02.02.1451) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA

### Mirzə Sultan Məhəmmədin Baburla müharibə etməsi

Mirzə Babur bir neçə gün İmad qalasında qaldıqda sonra şimşək və külək kimi Astarabad tərəfə yollandı. Xorasan camaatı Sultan Məhəmmədin yanında böyük etibara malik olan Əmir Hacı Məhəmməd Qana-

---

[833] Əbu-Məşər Cəfər ibn Məhəmməd ibn Ömər əl-Bəlxi (öl. 272 / 885) – riyaziyyat və astronomiya alimidir, IX əsrin görkəmli riyaziyyatçısı olmuş Yaqub ibn İshaq Kindinin tələbələrindəndir. 12 kitabın müəllifidir. Bu kitablardan yalnız "Qiranati-kəvakib" əsəri dövrümüzə çatmışdır *(Nəvai, şərhlər, s.459; Öztürk, şərhlər, s.290).*

[834] Abbasi xəlifəsi (h. 170-193 / m. 786-809)

[835] "Zici-Məmuni" – "əz-Zicül-mümtəhin" və "əz-Zicül-Şəmasiyyə" adları ilə də tanınan bu zic Abbasi xəlifəsi Məmunun əmri ilə Yəhya ibn Əbu-Mənsurun başçılıq etdiyi alimlər kollektivi tərəfindən h. 215-217 / m. 830-832-ci illərdə Bağdadın Şəmasiyyə adlı yerində tərtib edilmişdir *(Nəvai, şərhlər, s.459).*

[836] Bəttani adı ilə tanınan Əbu-Abdulla Məhəmməd ibn Cabir ibn Sinan əl-Hərrani görkəmli riyaziyyatçı alim olmuş, h. 317 / m. 929-cu ildə ölmüşdür. O, "əz-Zicüs-Sabi" adlı əsərin müəllifidir *(Nəvai, şərhlər, s.460).*

[837] Burada Xalid ibn Əbdürrəhman ibn Əbdülməlik əl-Mərvrudi nəzərdə tutulmuşdur. O, "Zici-Məmuni"nin tərtibi işində Sind ibn Əli və Abbas ibn Səid Cövhəri ilə birlikdə Yəhya ibn Əbu-Mənsura kömək etmişdir. Lakin Həsən bəy Rumlu yanlış olaraq, onun Bəttani ilə birlikdə zic tərtib etdiyini bildirir *(Nəvai, şərhlər, s.460).*

[838] Bu şəxs bir ehtimala görə, Bağdad riyaziyyatçılarından Əbu-Hamid Əhməd ibn Məhəmməd əs-Sağani əl-Üstürlabidir. O, Büveyhi hökmdarı Şərəfüddövlə ibn Əzüdüddövlənin zamanında (m. 983-989) Vicən ibn Rüstəmin rəsədxanasının qurulmasında və ulduzların tədqiqində iştirak etmiş, h. 379-cu ilin sonlarında / m. 990-cı ilin əvvəllərində vəfat etmişdir. Digər bir ehtimala görə isə, burada Əbül-Qasım Hibbətulla ibn əl-Hüseyn əl-Bədiüzzaman əl-Bağdadi əl-Üstürlabi nəzərdə tutulmuşdur. O, astronomiya və həndəsə alimi olmuş, "əz-Zicül-Mahmudi" adlı zic tərtib etmişdir *(Nəvai, şərhlər, s.460).*

[839] Əbül-Hüseyn Əbdürrəhman ibn Ömər ibn Məhəmməd ibn Səhl ər-Razi (öl. 391 / 1000) – Büveyhi hökmdarı Əzüdüddövlənin (m. 976-983) sarayının astronom alimlərindən olub, onun müəllimi idi. "Kitabül-kəvakibüs-sabitə" ("Sabit ulduzlar kitabı"), "Kitabül-ərcuzə fil-kəvakib" ("Ulduzlar haqqında qısa kitab") kimi əsərləri vardır *(Nəvai, şərhlər, s.460).*

[840] Əli ibn Əbdürrəhman ibn Yunis ibn Əbdüləali Misri, Fatimilər sülaləsindən olan Misir hökmdarı Hakim Biəmrillah (m. 996-1021) üçün "Zici-kəbir" ("Böyük zic") adlı əsər yazmışdır *(Nəvai, şərhlər, s.460).*

[841] Məşhur alim Əbu-Reyhan Biruninin (m. 973-1048) "Qanuni-Məsudi" əsəri nəzərdə tutulur *(Nəvai, şərhlər, s.461).*

[842] "Zici-şahi" adlanan bu əsər h. 527 / 1132-ci ildə tərtib edilmişdir *(Nəvai, şərhlər, s.461).*

[843] "Zici-əlayi" adında bir neçə əsər vardır. Bu əsərlər ayrı-ayrılıqda Əsirəddin Müfəzzəl ibn Ömər əl-Əbhəri, Nizamüləröc Həsən ibn Məhəmməd əl-Nişapuri, Müəyyəddin əl-Ərzi əl-Dəməşqi və Əlaəddin Nişapuri tərəfindən yazılmışlar.

[844] XII əsrin azərbaycanlı alimidiir. Ə.Nəvainin yazdığına görə, əl-Fəhhad ləqəbi ilə tanınan bu alimin qələmindən 6 zicin çıxdığı ehtimal edilir. "əz-Zicül-möhkəm", "əz-Zicül-müstövfi" və ya "əz-Zicül-mötədil", "əz-Zicül-müğənni" onun əsərlərindəndir *(Nəvai, şərhlər, s.462).*

[845] Görkəmli Azərbaycan alimi Nəsirəddun Tusi (m. 1201-1274) nəzərdə tutulur. Fövqəladə zəkasına görə "on birinci ağıl" (əqlihadi aşər) ləqəbi ilə tanınmışdır. Çünki Şərq perepatetik məktəbi yalnız 10 ağıl növünün mövcudluğunu qəbul edirdi. Şərq mütəfəkkirləri Tusiyə "on birinci ağıl" ləqəbini verməklə onun ağlının misilsiz olduğuna işarə edirdilər. Burada bəhs edilən "Zici-xani" əsəri daha çox "Zici-Elxani" adı ilə tanınmışdır.

[846] Möhyəddin Yəhya ibn Məhəmməd ibn Əbüşşükür əl-Məğribi əl-Əndəlüsi – "Zici-Elxani"nin hazırlanmasında Tusiyə kömək edən alimlərdəndir. Onun nücum haqqında "Ehkami-təhavili-siniül-aləm", "İxtiyarat" və "əl-Ərbəə məqalat fin-nücum" adlı əsərləri vardır *(Nəvai, şərhlər, s.462).*

şirinin zülm və cövründən cana doyduğu üçün dəstə-dəstə ümid üzlərini Mirzə Baburun dərgahına tutub gəldilər. Mirzə Sultan Məhəmməd bu məsələdən agah olub, Mirzə Əlaüddövləni Gərmsir hakimliyinə [təyin edib] yolladı və öz nəfis vücudu ilə Astarabada hərəkət etdi. Əmir Hacı Məhəmməd Qanaşirini cəsarətli dilavərlərdən [ibarət] bir dəstə ilə mənqəlay şəklində qabaqcadan göndərdi. Mirzə Babur şücaətli cavanlardan [ibarət] bir dəstə ilə onu qarşılamağa tələsdi. Məşhədrazda[847] iki qoşun üz-üzə gəldi. Çoxlu döyüşdən sonra Mirzə Babur qalib gəldi. İraq ordusu qaçış yolunu tutdu. Əmir Hacı Məhəmməd öldürüldü. O tərəfdən Mirzə Sultan Məhəmməd Tus vilayətində yükləri ("ağruq") Xoca Pir Əhməd Xəvafiyə həvalə edib tam sürətlə yürüşə başladı. Yolda yaralı, yorğun və üzgün adamlarla rastlaşdı. Mirzə Sultan Məhəmməd hökm etmişdi ki, qaçanların heç birindən vəziyyəti soruşmasınlar. Qəflətən üç yüz süvari ilə Baburun ordugahına yetişdilər və borğu[848] çalaraq gələr-gəlməz həmlə etdilər. Mirzə Babur xəbərsiz olduğu üçün onun əsgərlərinin hər biri bir tərəfə fərar etdi. Sonra Mirzə Babur yenə də İmad qalasına yollandı. Mirzə Sultan Məhəmməd gecəyədək o məkanda qaldı. O fikirləşirdi ki, bəlkə də, müxaliflər onu aldatmaq üçün öz yerlərini tərk etmişlər və məkr qurmaq düşüncəsindədirlər. Ona görə də Tus tərəfə qayıtdı və xəbər tutdu ki, onun ordugahı viran olmuşdur.

Həmçinin o əsnada Heratdan xəbər gəldi ki, Mirzə Əlaüddövlə Gərmsirdən həmin şəhərə tələsmiş və səltənət taxtına əyləşmişdir. Mirzə Sultan Məhəmməd bu xəbəri eşitdikdə əhvalı pərişan oldu. Dilə gətirdi ki, "heratlılar, təbii olaraq, Mirzə Əlaüddövlənin tərəfdarlarıdırlar; məsləhət budur ki, İraqa gedək". Əmirlər bu sözü qəbul etdilər. Ona görə də İraqa yollandılar.

Sultan Məhəmmədin getməsindən sonra Mirzə Babur İmad qalasından Herata hərəkət etdi. Mirzə Əlaüddövlə İxtiyarəddin qalasını Əhməd Yasavula tapşırıb Bəlx tərəfə tələsdi. Mirzə Babur təntənə ilə Herata gəldi. Əhməd Yasavul qalanı təslim etdi. O zaman Mirzə Babur çoxlu ordu ilə Bəlxə yönəldi. Mirzə Baburun gəlişindən xəbər tutan Mirzə Əlaüddövlə Bədəxşanın dağlıq hissəsinə tələsdi. Mirzə Babur sürətli yürüş edib onun üstünə getdi və qəflətən onun ordugahını ələ keçirdi. Mirzə Əlaüddövlə çox məşəqqətlə arvad-uşağını qoyub fərar etdi. Mirzə Babur Bəlxə hərəkət etdi və o şəhərin hakimliyini Pir Dərviş Həzarəsbiyə lütf edərək Herata yola düşdü.

### Mavəraünnəhr məmləkətlərinin vəziyyəti

Mirzə Əbdüllətif atasının və qardaşının qətlindən sonra səltənət taxtında qərar tutdu. Mirzə Uluğ bəyin və Mirzə Əbdüləzizin nökərlərindən [ibarət] bir dəstə bir-biri ilə ittifaq edib, cümə gecəsi, 854-cü ilin rəbiüləvvəl [ayının] 26-da (09.05.1450) o divə bənzər hökmdar Çinar bağından Səmərqəndə gəldiyi vaxt pusqudan ona bir ox atdılar və həmin ox öz məqsədinin hədəfinə yetişdi. Mirzə Əbdüllətifin mülazimləri pərişan oldular. Düşmənlər özlərini ona yetirib başını bədənindən ayırdılar və Mirzə Uluğ bəy mədrəsəsinin tağının önündən asdılar.

Mirzə Əbdüllətifin padşahlığının müddəti altı ay olmuşdur. O, atasının qətlindən sonra həmişə bu beyti təkrar edirdi:

Beyt

"Ata qatilinə padşahlıq yaraşmaz,
Və əgər yaraşsa da, altı aydan çox çəkməz".

Qəribə təsadüflərdən biri odur ki, Mirzə Əbdüllətif, Baba Hüseyn adlı birisinin əli ilə öldürüldü və atasının qətlinin tarixində olduğu kimi, tale qələmi onun öldürülməsini də [qatilinin adı ilə] "Baba Hüseyn öldürdü" şəklində yazdı[849].

Şeir

Baba Hüseyn öldürdü cümə gecəsi qılıncla,
Onun qətlinin tarixidir "Baba Hüseyn öldürdü"[850].

---

[847] Hazırda İranın Məşhəd vilayətində Məşhədriz kəndi mövcuddur və ehtimal ki, burada adı çəkilən Məşhədraz elə həmin kənddir *(Nəvai, şərhlər, s.463).*

[848] Borğu – şeypur tərzində nəfəsli musiqi aləti. Hərbi əməliyyatlar zamanı istifadə olunurdu.

[849] Atasının qatili Abbas adlı şəxs idi və atasının ölüm tarixi (h. 853) "Abbas koşt" ("Abbas öldürdü") ifadəsində əksini tapmışdır *(Nəvai, şərhlər, s.465).*

[850] "Baba Hüseyn koşt" = 854 h.

Xülasə, Mirzə Əbdüllətif xeyli şücaətli olmasıyla vəsf edilən, təlif təbiətli olmasıyla tanınan bir padşah idi. Zehni çox iti, fəhmi son dərəcə mükəmməl idi. Müxtəlif biliklərdən bəhrələnmiş, cürbəcür elmlərdə şöhrət tapmışdı. Tarix və nücum fənlərini bilirdi və dini məsələlər barədə layiqli mübahisələr etməyi bacarırdı.

Mirzə Əbdüllətifin [ölüm] hadisəsindən sonra Səmərqəndin böyükləri və əyanları Mirzə Abdulla Şirazini məcazi olaraq padşah etdilər. O, mülkün və malın tədbirini Əmir İbrahim İdigü Temurun əlinə verdi. Şiraz əmirləri ona həsəd apardılar və onu Mirzə Uluğ bəyin oğlu Əmir Əbdürrəhmana havadarlıq göstərməkdə ittiham edərək həbsə aldılar. Qırx gündən sonra onu Mirzə Əbdürrəhmanla birlikdə qətlə yetirdilər. Böyük əmirlərdən Sultan Əhməd Temurtaş, Əmir İbrahimin övladları, Əmir Bayəzidin oğlu, Əlaüddövlə və b. adlı-sanlı əmirlər şahzadənin dərgahından ayrılıb Xorasana yönəldilər. Mirzə Əbdüllətifin həyatının son günlərində həbsdən qaçıb Buxaraya getmiş Mirzə Sultan Əbu-Səid bu xəbər yayıldıqdan sonra həmin şəhəri zəbt edib Səmərqəndə doğru hərəkət etdi. Mirzə Abdulla onu qarşılamağa tələsdi. İki tərəf arasında müharibə baş verdi və Səmərqənd ordusu qalib gəldi. Mirzə Sultan Əbu-Səid Türküstan diyarına sarı üz tutub bir müddət o vilayətdə qaldı.

Bu əsnada Mirzə Abdullaya xəbər çatdı ki, Mirzə Əlaüddövlə Bəlxə gəlmişdir və Səmərqəndə hücum etmək niyyətindədir. Ona görə də Mirzə Abdulla Səmərqənd tərəfə döndü. O iki ali mənşəli padşah döyüşmədən və vuruşmadan hərəsi öz vilayətinə geri qayıtdı.

### Rum diyarında baş vermiş hadisələr haqqında söhbət

Bu il Rum padşahı Sultan Murad saydan-hesabdan artıq, yağışın damlalarından və səmanın yağmurundan daha çox bir ordu ilə Arnavut diyarına yollanıb Akçahisar[851] ətrafında dayandı. Ora olduqca mətanətli bir qala idi. Şəhər kiçik olsa da, son dərəcə möhkəm idi. İzdihamlı ordu o qalanı mərkəz kimi əhatəyə alıb döyüşə başladı. Rumilərdən bir çoxları öldürüldü. Ona görə də Sultan Murad qalanı fəth etmədən Ədirnəyə döndü. Həmin qış Zülqədəroğlu ilə qohum olmaq fikrinə düşdü və Zülqədəroğlunun qızı olan möhtərəm padşah qızını öz oğlu Sultan Məhəmmədə aldı. Elçinin gəliş-gedişindən sonra Zülqədəroğlu qəbul etdi və [Sultan Məhəmməd] onun qızını tam əzəmətlə Ədirnəyə gətirib zifaf etdi[852].

### 855-Cİ İLDƏ (03.02.1451 – 22.01.1452) BAŞ VERMİŞ HADİSƏLƏR

Bu il Sultan Murad vəfat etdi. Oğlu Sultan Məhəmməd miras qalmış mülk və qeysərlik[853] taxtı ona mənsub olduğu üçün taxtda əyləşdi. İbrahim bəy Qaramanoğlu əzəli nifaq və əbədi səadətsizliyi üzündən müxaliflik etməyə başladı. Fikirləşdi ki, bu sultan növcavandır, indi ömrünün çiçəklənən vaxtında və kam alan çağındadır, cahandarlıq təcrübəsi azdır, dövlətinin düşmənlərinin hamısı yüksək dərəcəli padşahlardır, bədxahlarının əsgərləri saysızdır, hamısı da müsəlmanlar və kafirlərdir[854] və o, işin aqibətini anlaya bilməz və kəcrəftar fələyin qurduğu oyunu dərk edə bilməz. Buna görə də fitnə-fəsad tozunu qaldırdı və öz oğullarından birini bəndələrin məskənlərini talamaq üçün Gərmiyan məmləkətinə göndərdi. Digər oğlunu isə qırıb-biçən qoşunla və sitəmkar zalımlarla Məntəşə vilayətinə basqın etməyə yolladı. O səbəbdən o diyarın müsəlmanlarına və kafirlərinə çoxlu ziyan dəydi. Anadolu əmirülümərası Ozğuroğlu İsa bəy bu xəbəri Sultan Məhəmmədə göndərdi. Ona görə də Sultan Məhəmməd, Qaraca paşanı kafirlərin sərhədini mühafizə etmək üçün Bosnaya göndərdi və özü əndazəyə və müqayisəyə gəlməyən bir həşəmətlə və xəyala sığışmayan bir ordu ilə Qaraman vilayətinə tərəf hərəkətə gəldi. İshaq paşanı bir dəstə bahadırla mənqəlay [təyin] etdi. Bəhram kimi qəhredici ordu Ağşəhər ətrafına gəldikdə, İbrahim bəy Qaramanoğlu çör-çöpün bərk küləkdən qaçdığı kimi fərar edib Daşeli dağlarına[855] sığındı.

---

[851] Albaniyada yerləşir və digər adı Kroyadır *(Nəvai, şərhlər, s.467).*

[852] Haqqında bəhs edilən xanım, Zülqədər bəyliyinin başçısı Süleyman bəyin qızı Sitti xatundur *(Nəvai, şərhlər, s.467-468).*

[853] Klassik Şərq ədəbiyyatında Roma və Bizans imperatorları Sezar adının təhrif olunmuş forması olan "qeysər" titulu ilə tanınırdılar. İstanbulun türklər tərəfindən fəthindən və Bizans imperiyasının süqutundan sonra qeysər titulu Osmanlı sultanlarına şamil edilməyə başlandı. Səfəvi mənbələrində qeysər adı altında Osmanlı sultanları nəzərdə tutulur.

[854] Yəni həm müsəlman, həm də kafir hökmdarlar onun düşmənidirlər.

[855] Daşeli (Taşili) – Orta Toroslarda, Türkiyənin Alanya şəhərinin şərqindən başlayan qayalıq bir bölgə.

Ona görə də sultanın ali bayraqları son dərəcə əzəmət və səadətlə Daşeli ətrafında dayandılar. Sultan qoşununun gücünü və qüvvəsini müşahidə edən və onun şan-şövkətli çətirlərinin qol-qanad açdığını görən İbrahim bəy, ayağı iztirab və əlacsızlıq tələsinə düşmüş kəkliyə döndü. O, təfəkkür mənzilində və heyrət dalanında aciz qaldı. Onun ürəyini tamamilə xof bürüdü. Onun bəxt gündüzü tutqun və qara oldu. Məyusluq və qorxudan onun üzü saraldı. Padşahın şiddətinin isti və qızmarından onun bədəninin dərisi ilan dərisi kimi çatladı. O, özünün yanlış əməlindən peşman oldu. Acizlik və itaətdən bəhs edən, tövbə etdiyini bildirən bir məktubu o zamanın fazillərindən seçkin və müstəsna olan Mövlana Vəli ilə padşahın dərgahına göndərib xahiş-minnət etdi və öz günahını yumaq və ordusunun basqınına görə üzrxahlıq etmək üçün Ağşəhər və Bəyşəhər şəhərlərini ətraf ərazilərlə birlikdə möhtəşəm sultana peşkəş etdi. Şah üçün, ordu və dövlət ərkanı üçün hər cür hədiyyələr göndərdi[856]. Ona görə də sultan əhd-peyman bağlandıqdan və “Quran”a and içildikdən sonra onun günahlarından keçib Ədirnə şəhərinə döndü.

İbrahim bəy tüğyan etdiyi zaman Məntəşa və Gərmiyan övladları müxaliflik izhar etmişdilər. Ona görə də sultan İshaq paşanı kinli bir ordu ilə o azğın tayfanı qırıb-biçməyə göndərdi. Qəhr olmuş müxaliflər müzəffər əsgərlərin gəlişindən agah olduqda, hamısı pərən-pərən düşüb avara oldular. İlyas bəy Məntəşaoğlu o həlak girdabından xilas olub, yolları qət etdikdən sonra bir gəmiyə oturaraq özünü Rodos adasına[857], kafirlərin arasına saldı. Beləliklə, o, küfrü və nifaqı bir-biri ilə birləşdirdi. Sultan, Qaraman səfərindən qayıdarkən Bursa yaxınlığında yeniçərilər camaatı sultanın yolunun üstündə səf çəkib dayandılar və dövlət ərkanının vasitəçiliyi olmadan, müflis, pərişan və yoxsul vəziyyətlərini dilə gətirib şikayət etdilər, ənam və bəxşiş istədilər. Özlərinin xidmətkar və fədakar olduqlarını söylədilər. Bu arsızlıq sultanın könlünə ağır gəlsə də, hər biri otuz min axça olan otuz kisə gümüş dirhəmi o camaatın möhtaclarına payladı. Amma yeniçəri böyüklərinə yüz çubuq vurdurdu və onları xidmətdən və mənsəbdən uzaqlaşdırdı. Onların hər birinin yerinə bəndələrdən bir başqasını təyin etdi.

### Xorasan diyarında baş vermiş hadisələr, Baysunqurun oğlu Məhəmmədin yenidən Xorasan tərəfə qoşun çəkməsi və Çinaran mövqeyində səltənət arxından su içən sərvin yıxılması haqqında söhbət

Mirzə Babur müzəffər və qalib şəkildə darüssəltənə Herata çatdıqda gördü ki, yetərincə qəribə bir hadisə üz verib. Bu əhvalatın təfsilatı belədir ki, Mirzə Babur Herata doğru hərəkət edərkən İxtiyarəddin qalasını Üveys bəyə tapşırmışdı. Üveys bəy öz beyin sarayına xülya və qürur buxarını buraxıb, istiqlal xəyalı ilə qalanı müdafiə etmək üçün hazırlıq görərək fitnə-fəsad, zülm və inad bayrağını qaldırdı. Mirzə Babur Bəlx yürüşündən geri dönüb Sefid bağında yerləşdiyi zaman Üveys həmçinin üsyan məqamında idi. O qala son dərəcə mətanətli olduğu üçün əmirlər oranı fəth etməyə aciz qaldılar. Axırda cahangir hökmdarın nurlu könül aynasında bir tədbirin surəti göründü. O, öz mülazimlərindən birini Üveysin yanına göndərib [bildirdi] ki, “sən qaladan kənara qədəm qoyma, çünki mən özüm oraya gələcəyəm”.

Sonra bir gecə Cəmşid məqamlı padşah şəhərə təşrif gətirib əvvəlcə bir dəstə saz əhlini qalaya yolladı. Ardınca isə bir dəstə bahadırı göndərdi. O dəstə qala qapısına gedib səs saldı ki, mirzə gəlmişdir. Üveys bu xəbəri eşitdikdən sonra qalanın dəhlizinə qədər onu qarşılamaq üçün çıxdı. Şeyx Mənsur adlı birisi ona hücum etdi. Üveys bəy bir xəncər yarası ilə onu həlak etdi. Digər dilavərlər özlərini Üveys bəyə yetirib onun xəbis ruhunu cəhənnəmə göndərdilər. Üç gün içində qardaşı Yusifşah qalanı təslim etdi. Mirzə Babur onu da Üveysin ardınca göndərdi.

Bu əsnada Mirzə Əlaüddövlənin adamlarından biri Mirzə Baburun yanına gəlib ərz etdi ki, “cənab padşah Heratın ətrafına çatıb Gazərgah ətəyində itdi”. Mülazimlərdən [ibarət] bir dəstə hökmə uyğun olaraq, onu axtarmaqla məşğul oldu. Mirzə Əlaüddövləni İsgəndər bəyin otağında tapıb oradan bayıra çıxardılar. Mirzə Babur etimadlı adamlarından birini onu mühafizə etməyə təyin etdi.

855-ci (1451) ildə Astarabadda qışlaq etməyə yollandı. Sultan meydanına[858] çatdıqda cahanı gəzən atının yüyənini Bistam tərəfə döndərdi və bir neçə gün səadətli hökmdar o məkanda qaldı.

---

[856] Qızını da Osmanlı sultanına ərə verdi *(Nəvai, şərhlər, s.470)*.

[857] Rodos – Egey dənizində hal-hazırda Yunanıstana aid olan ada. O dövrdə xristian cəngavərlərin əlində idi.

[858] “Sultan meydanı” – güman ki, İranın Nişapur bölgəsindəki Meydani-sultan kəndidir *(Nəvai, şərhlər, s.472)*.

Mirzə Sultan Məhəmməd bu ilin axırında Fars, İraq, Kürdüstan və Luristan qoşunlarını cəmləyib Xorasana yürüş əzmi ilə yola çıxdı. Onun zəfər nişanlı məiyyəti İsfahana çatdıqda Mirzə Babur bu xəbəri eşidib, o günlərdə Səmərqənddən gəlmiş Xoca Mövlananı elçi kimi qardaşının yanına göndərdi və sülh istədi. Mövlana çox cəhd göstərdi. Xeyli səylərdən sonra belə bir sülhün bağlanması qərara alındı ki, Xorasanın kiçik bir vilayəti İraqa daxil edilsin və orada xütbə ilə sikkə Mirzə Sultan Məhəmmədin adı ilə bəzədilsin və zinətlənsin.

Mövlananın qayıtmasından sonra Mirzə Babur sülhə etimad bəsləyib Bistamdan Mazandaran tərəfə getdi. Onun əsgərləri qışlaq üsuluna uyğun yaraqlanmışdılar. Qəflətən xəbər gəldi ki, Mirzə Sultan Məhəmməd əhd-peyman dəftərini unutqanlıq tağı üzərinə qoyub çoxsaylı ordu ilə İsfərayinə çatmışdır. Mirzə Babur bu xəbəri eşitdikdə düşməni qıran qoşunlar və ər basan bahadırlarla hərəkət bayrağını müxaliflərə doğru qaldırdı. Mirzə Sultan Məhəmməd Xorasana gəldikdə vilayətin ətrafına əmirlər və daruğalar yolladı. O cümlədən Əmir Əbdürrəhimi Quhistana təyin etdi. O, Qainə[859] çatdığı zaman Əhməd Yasavul o diyarın hakimi idi. [Əhməd Yasavul] Tun hakimi Qaraman Türkmanla ittifaq halında onunla müharibə edib onun başını Mirzə Babura göndərdilər. Mirzə Baburun Mazandarandan çıxması xəbərini eşidən Mirzə Sultan Məhəmməd İsfərayindən qayıdıb Astarabada yola düşdü. Çinaran[860] mövqeyində izdihamlı qoşunlar bahar buludu kimi coşaraq və gurlayaraq bir-birinə çatdılar. Döyüş sahəsi rəngarəng qılıncların ildırımından yaşıllığa və yasəmənliyə döndü. Hərb meydanının havası nizələrin uclarındakı bayraqlardan gülüstana və laləzara çevrildi. İgidlərin oxlarından səhranın səthində meşə əmələ gəldi. Günəş [şüalarını] əks etdirən süngülərdən havanın üzü göz qamaşdıran parıltı ilə doldu.

Beyt

“Nizənin gözündən atəş çıxdı,
Yer döndü qan dənizinə”.

Mirzə Sultan Məhəmməd o vurhavurda qiyamət günü nişanələrini meydana gətirdi. Əmir Əhməd Firuzşah sol cinahdan həmlə edib, Mirzə Baburun sağ cinahında olan Şir Əhmədi məğlubiyyətə uğratdı[861]. Sultan Məhəmmədin yanından gəlmiş Əbu-Səid Mirəm, Mirzə Sultan Məhəmmədin böyük “qol” üzərinə gəldiyini ərz etdi. Sonra elə bu əsnada qara ürəkli Mirzə Sultan Məhəmməd ordunun mərkəzinə həmlə edib mərkəzin ortasına soxuldu. Xorasan əsgərləri cürət ayağını önə qoyub iraqlıların Mirzə Sultan Məhəmmədə qoşulmalarına imkan vermədilər. Vuruşmanın müddəti uzandı və axırda İraq qoşununa ağır məğlubiyyət üz verdi. Mirzə Sultan Məhəmməd əsir tutuldu. Xorasan hökmdarı süvari halda dayandığı vaxt Mirzə Sultan Məhəmmədi əli yaralı vəziyyətdə gətirdilər. Mirzə Babur tənə etmək üçün dilə gəlib dedi:

- Mən nə günah etmişdim ki, iki dəfə Xorasana qoşun çəkdin və özünü belə bir bəlaya saldın?!

Mirzə Sultan Məhəmməd dedi:

- Mülkün (dövlətin) işi bunlarsız olmaz.

Sonra məmurlar onu Babur mirzənin qarşısından apardılar. Mirzə Sultan Məhəmməd bir dəsmal götürdü ki, öz yarasını bağlasın. Məmurlar dedilər:

- İş işdən keçib. Artıq yaranı bağlamağının mənası yoxdur.

Mirzə Sultan Məhəmməd dedi:

- Babur mərhəməti ortadan qaldırıbmı?

Dedilər:

- Bəli.

Dedi:

- Bəs məni hara aparırsınız?

Mirzə Baburun mülazimlərindən biri onu qətlə yetirdi.

Nəql edirlər ki, Mirzə Sultan Məhəmməd İsfərayin ətrafında dayandığı zaman bargah əmirlərini çağırıb onların könlünü aldı. O əsnada təqribən üç min cavan eyni anda sarıqlarını başlarından açaraq dedilər ki,

---

859 Qain – İranın şərq hissəsində, Xorasanın Bircənd bölgəsində bir qəsəbədir *(Öztürk, şərhlər, s.374)*..

860 Çinaran – Məşhəddən şimal-qərbdə yerləşən şəhər.

861 “Əmir Nizaməddin Əhməd ibn Firuzşah, Baburun tərəfindən Astarabad hakimi olan Şir Əhmədi qətlə yetirdi” *(Nəvai, şərhlər, s.474)*.

“bizim canımız sənə fədadır!”. Lakin ertəsi gün şahzadə əcəl saqisinin əlindən ölüm qurtumunu içdiyi vaxt onlar fərar etmişdilər. Belə ki, həmin üç min cavandan bir nəfər belə öldürülməmişdi.

Mirzə Babur qardaşı tərəfdən xatircəm olduqdan sonra ordugahda məhbus saxlanan Mirzə Əlaüddövlənin [gözlərinə] mil çəkdirdi. Amma həmin çirkin işin icraçısı o cənaba rəhm edib mili onun göz bəbəklərinə çəkmədi.

Ondan sonra Baburun günəş kimi parlaq bayraqları İraq tərəfə hərəkətə gəldi. Səbəbi bu idi ki, Mirzə Sultan Məhəmməd Rey yolundan gəlmişdi və oranın taxılını tələf etmişdi. Məşvərətdən sonra belə qərar verildi ki, Yəzd yolundan Şiraza yönəlsinlər. İraqa bu yolla getmək qərarı onların tədbir pərdəsindən çıxan ilk iş idi ki, ənənədən və qayda-qanundan xaric idi. Çünki onların fələk iqtidarlı sultanların keçiş yeri olmayan həmin yolla irəliləmələrini Cahanşah padşah, Mirzə Baburun ordusunun zəifliyi kimi yozdu. Onun digər bir xətası (səhvi) da bu idi ki, Azərbaycana göndərdiyi məktubun arxasına möhür vurmuşdu[862]. Ona görə də türkmanlar vilayətə tamah saldılar.

Hökmdarın məiyyəti Tun şəhərindən keçdi. O diyarda da taxıl az idi və rəiyyət qiymətin bahalaşacağı düşüncəsi ilə taxılı gizlətmişdi. Kələntərlər taxıl satışını rəiyyətə qadağan etmişdilər. Mirzə Babur buyurdu ki, harada taxıl tapsalar, ələ keçirsinlər. Əsgərlər evlərə tökülüb, nə tapdılarsa apardılar. [Mirzə Babur] cah-calalla darülibadə[863] Yəzdə gəldi. Mirzə Sultan Məhəmmədin əmirləri Əmir Nizaməddin Əhməd və Əmir Sultan Hüseyn, Əmir Firuzşahın və Xoca Qiyasəddin Pir Əhməd Xəvafinin oğulları onun hüzuruna gəlib onunla görüşmək şərəfinə nail oldular və padşahın büsatını öpməyin izzəti ilə iftixar qazandılar. Səadətli bayrağın hümay quşu Şiraz fəthinin havası ilə pərvaza gəldi və darüssəltənə Şirazda cah-calalla dayandı. O zaman Mirzə İsgəndər Türkmanın oğlu Əlvənd, Mirzə Baburun fələk kimi möhtəşəm məiyyətinə qoşuldu.

### Mavəraünnəhrdə baş vermiş hadisələr, Mirzə Abdulla Şirazinin öldürülməsi və Sultan Əbu-Səidin hakimiyyət və baş ucalığı taxtına əyləşməsi haqqında söhbət

Bu il Sultan Əbu-Səid Yəsi qalasını[864] ələ keçirdi. Mirzə Abdulla bu hadisədən agah olduqda, qışın ortasında bahadırlar dəstəsini onu dəf etməyə yolladı. Sultan Əbu-Səid şəhərə sığındı. Səmərqənd əmirləri hiddət və kinlə qalanı üzük qaşı kimi dövrəyə aldılar. Sultan Əbu-Səid öz mülazimlərinə gecə özbəklərin paltarını geydirib onları şəhərdən bayıra göndərdi. Gündüz vaxtı [uzaqdan] qaraltı göründü. Səs saldılar ki, özbək ordusu köməyə gəlir. Şəhərdə şadlıq nağarası çaldılar. Mirzə Abdullanın qoşunu mallarını və əşyalarını qoyub Səmərqənd tərəfə qaçdı. Onların bir dəstəsi aman istəyib [Əbu-Səidin] mülazimi oldular.

Mirzə Abdulla ixtiyar yüyənini Məhəmməd bəyə verdiyi üçün onu tamamilə özündənrazılıq və təkəbbür bürümüşdü. Əmirlər və dövlət ərkanı onun əlindən cana doymuşdu. Vəzir Xoca Ətaulla Şirazi də şıltaqlıq qapılarını açıb, illərlə yığılmış vergi borclarını məmləkət əhlindən tələb edirdi və həm say-seçmə adamları, həm də sadə camaatı mühəssillərin[865] əlində giriftar etmişdi. Ona görə də onlar Sultan Əbu-Səidin dərgahına üz tutdular. Məğlub ordu Səmərqəndə çatdıqda Mirzə Abdulla xəzinələrin qapılarını açıb, kiçiklərə və böyüklərə çoxlu qızıl ənam verərək Yəsi tərəfə hərəkətə gəldi.

Bu xəbər Sultan Əbu-Səidə çatdıqda iş bilən elçilərini Əbülxeyr xanın yanına göndərib kömək istədi. Ona görə də Əbülxeyr xan çoxsaylı ordu ilə Sultan Əbu-Səidə qoşuldu. O iki xoşbəxt bir-biri ilə ittifaq halında, həddən-hüduddan artıq bir ordu ilə Daşkənd və Xocənd yolundan keçib Səmərqəndə yönəldilər. Otsuz bir çöl olan Dizəq səhrasına[866] çatdıqları vaxt zəhərli (isti) küləyin əsməsi ucbatından adamlar və atlar həlak olmağa başladılar.

Nəzm

“Oranın səmum küləyi o qədər can aldı ki,

[862] Mirzə Məhəmmədin ölümündən sonra Mirzə Babur bu hadisələri məktub şəklində yazaraq Cahanşaha göndərmiş və onun bu hərəkəti Cahanşahın istiqlaliyyətini möhkəmlətmişdi. Çünki o, Cahanşaha özünə bərabər hökmdar kimi məktub deyil, fərman göndərməli idi və orada Cahanşahdan hər il Azərbaycanın bac-xəracını Herat xəzinəsinə göndərmək, Teymuri hökmdarı adına xütbə oxudub sikkə zərb etmək tələb olunmalı idi *(Nəvai, şərhlər, s.476).*

[863] Darülibadə – “ibadət məkanı” deməkdir. Bu epitet İranın Yəzd şəhərinə aid olunurdu.

[864] Yəsi – Qazaxıstan cənubunda yerləşən indiki Türküstan şəhəri. Məşhur sufi şeyxi Seyid Əhməd Yəsəvi bu şəhərdə yaşamışdır.

[865] Mühəssil – vergi məmuru.

[866] Dizəq səhrası, Daşkənd – Səmərqənd yolu üzərindədir *(Nəvai, şərhlər, s.478).*

Sur nəfəsinə[867] utanc bəxş etdi.
Çör-çöplə dolu o qorxunc vadidə,
Çoxlu əcəl qartalları uçmaqda idi.
Oranın gülləri tikan kimi, tikanları da neştər kimi idi,
Atəşli gili sanki yanar köz kimi.
Xətərlə dolu olan o təhlükəli vadidə,
Yüksək günəşdən başqa kimsə dolaşa bilməzdi.
Oranın küləyinin qaldırdığı tozanaq burulğanından,
Başını mavi göyə çatdıran bir toz minarəsi yaranmışdı".

Xan buyurdu ki, "yədə" etsinlər[868]. Günəş xərçəng bürcündə (22 iyun – 22 iyul) olmasına baxmayaraq, bərk soyuq meydana gəldi.

Mirzə Abdulla, Sultan Əbu-Səidlə Əbülxeyr xanın gəlişindən agah olduqda qantökən ordu ilə onları qarşılamağa tələsdi. Cəmadiyülaxırın (1451-ci ilin iyul ayının) sonunda Səmərqəndin dörd fərsəxliyində yerləşən Şiraz kəndində[869] hər iki ordu bir-birinə yetişdi. Mirzə Abdulla öz nəfis vücudu ilə özbək ordusuna həmlə edib bir dəstəni həlak torpağına saldı.

Beyt

"Haraya əl uzatdınsa,
Düşmənin başını ayağına atdın".

Mirzə Sultan Əbu-Səid bir dəstə özbəklə düşmənin mərkəzinə həmlə etdi.

Beyt

"Ox və nizə ilə, iti qılıncla,
Düşmənlərə məhşər gününü göstərdi".

Öldürülənlərin bədənindən səhranın üzündə təpə yarandı. Ölülərin üzərindəki yaralı ürəklilərin qanından qırmızı çay axdı.

Beyt

"Öldürülənlərdən zəfəran rəngində təpə yarandı,
Qandan ərğəvan rəngində çay axdı.
Sanki zərli göydən dolu yağdı,
Dolunun ətrafında lalə ləçəyi açdı".

Günəşin zərli görkəminin gümüş simalı üfüqdən doğuşu vaxtından etibarən onun yüksəliş dərəcəsinə uyğun olaraq, qırğın və savaş alovu da yuxarı qalxırdı. Gönorta vaxtı yaxınlaşdıqda döyüş atəşi yatdı. Çalışvuruşdan sonra qələbə yeli Sultan Əbu-Səidin bayrağının pərçiminə əsdi. Xanın hökmü ilə Mirzə İbrahimin oğlu Mirzə Abdulla əbədiyyət aləminə yollandı.

Sultan Əbu-Səid bilirdi ki, əgər özbək qoşunu Səmərqəndi istila etsə, oranın kiçiklərinə və böyüklərinə çox zərər verəcəkdir. Ona görə də Səmərqənd darvazasına çatdıqları zaman onu mühafizə edən özbək əmirinə dedi ki, "əvvəlcə atları suvaraq, ondan sonra hara məsləhət olarsa gedərik". Özbək əmiri razılaşdı. Heyvanları qalanın yaxınlığındakı su arxına sürdülər. Özbək əmirinin atı su içdi. Sultan Əbu-Səidin atı hələ suya doymasa da, o, arxdan çıxdı və ata bir qamçı vurub darvazaya çapdı. Səsləndi ki, "mən Sultan Əbu-Səidəm; darvazanı açın ki, özbəklərin hücumundan salamat qalasınız". Şəhər əhli dərhal darvazanı açdı. Səadətli sultan Səmərqəndə daxil oldu və bürclərlə qala divarlarını möhkəmləndirməklə məşğul oldu. Əbülxeyr xan [şəhərin] kənarında çaş-baş və sərgərdan qaldı. Sultan Əbu-Səid xoş sözlər və bəyənilən söhbətlərlə ona xəbər yolladı və xan üçün, özbək əmirləri üçün layiqli hədiyyələr və müvafiq töhfələr göndərdi. Ona görə də onlar öz diyarlarına qayıtdılar.

---

[867] "Sur nəfəsi", "sur çalınması", "sur səsi" – qiyamətin qopmasını bildirən dini bir termindir.
[868] Yədə və ya cədə, yada – qədim türk mifologiyasında yağış yağdırmaq, havanı sərinləşdirmək üçün istifadə olunan daşlara deyirlər.
[869] Şiraz kəndi – Səmərqənddən dörd fərsəx şimalda yerləşirdi *(Nəvai, şərhlər, s.478)*.

**Ölümlər**

Sultan Murad ibn Sultan Məhəmməd ibn İldırım Bayəzid ibn Sultan Murad ibn Orxan ibn Sultan Osman ibn Ərtoğrul bu il dünyadan köçdü. Səltənət müddəti otuz il idi. Məmləkəti Rumeli, Anadolu və Təkkəeli olmuşdur. Səltənəti əyyamında üç döyüş etmişdir: ilk döyüşünü İbrahim bəy Qaramanoğlu ilə, ikinci döyüşünü Engirüs kralı ilə və üçüncü döyüşünü Yanko və b. Firəng sultanları ilə keçirmişdir. Ölümündən sonra oğlu Sultan Məhəmməd çaharşənbə günü, məhərrəmül-həram [ayının] başlanğıcında (03.02.1451) səltənətə əyləşdi[870].

Həmçinin bu il Mirzə Sultan Məhəmməd ibn Baysunqur ibn Şahrux padşah ibn Sahibqiran Əmir Teymur Kürəkan öldürüldü. Səltənətinin müddəti beş il olmuşdur. Məmləkəti İraq və Fars idi.

## 856-CI İLDƏ (23.01.1452 – 12.01.1453) BAŞ VERMİŞ HADİSƏLƏR

### Əbu-Səid Kürəkanın Əndican ölkəsi tərəfə qoşun çəkməsi

Bu il Xüttəlan hakimi Əli Barlas yersiz bir vahiməyə qapılaraq İsan Buğaya pəna apardı. Bu üzdən o da ayağını itaət yolundan kənara qoyub Əndican məmləkətini qarət etdi. Ona görə də Sultan Əbu-Səid yekşənbə günü, səfər [ayının] 7-də (28.02.1452)[871] qələbə nişanlı qoşunla bədbəxt müxaliflərin üzərinə hərəkət etdi. Şahruxiyyənin ətrafı dənizin və qurunun hökmdarının dayanacaq yerinə çevrildikdə dövlət ərkanı və dərgah əmirləri ərz etdilər ki, "zəlalət yolunun azmışları və cəhalət çölünün sərgərdanları olan bir dəstə özbək ətrafda çoxlu dağıntılar törətmişlər". Sultan, Əmir Əhməd Tərxanı bir dəstə bahadırla o yaramazları dəf etməyə göndərdi və özü nəfis vücudu ilə müxaliflər tərəfə hərəkət etdi.

Əxsi ətrafı müzəffər əsgərlərin çadırlarının qurulduğu yer olduqda İsan Buğa qaçış yolunu tutdu və Əli Barlas o müqayisəyəgəlməz qoşunun xofundan bir dəstə moğol əmiri ilə Əndican qalasına pənah apardı. Ora elə möhkəm bir qaladır ki, onun divarı ay qəsrinin küngürəsindən keçmişdir və xəndəyinin dibi yer öküzünün belinə çatmışdır[872].

Şeir

"Hündürlüyü qeyrət divarı kimi uca,
Bürcləri vəfa qalası kimi möhkəm.
Mələk onun ətrafında təvaf etməyə alışmış,
Fələk onun bürcündə dolaşan bir top kimi.
Onun çənbəri möhkəmlikdə dəmir kimi,
Qapısı ümidsizlik darvazası kimi bağlı.
Ürəyi düşmənlərin ürəyindən daha sərt,
Bütün dostların üzünə bağlayıb qapını".

Bu xəbər alinəsəb padşaha çatdıqda qoşun başçıları olan Əmir Əhməd Temurtaşı, Qiyasəddin Əfzəli, Əmir Cahanşahı, Xoca Cəmaləddini, Kəmaləddin Mahmud Xoca Laqı, Əmir Sultan Ərğunu və Mübarizəddini, səadət nurlarının alnından parladığı Nurəddin Səidi, Şəmsəddin Məhəmmədi, o şövkətli ordunun arxası və pənahı olan Zəhirəddin Musanı, habelə Əlaəddin Mübəşşiri və İmadəddini bir dəstə qoşunla mənqəlay şəklində qabaqcadan göndərdi. Düşənbə günü, rəbiüssani ayında (21.04-19.05.1452) son dərəcə əzəmət və səadətlə qala ətrafına gəldi. Sultanın təntənəsi və şövkəti ucbatından yiyəlik və sahiblik yüyəni onların zəbt və ixtiyar əlindən çıxdı. İki gün sonra qala əhli aman istəyib qalanı təslim etdi. Sultan Əbu-Səid o qalanın hakimliyini Cəlaləddin Bozorg Sulduza həvalə edib Səmərqənd tərəfə qayıtdı.

---

[870] H. 855-ci il məhərrəm ayının 1-də II Murad Ədirnədə vəfat etmiş, onun Manisada olan oğlu II Məhəmməd isə Ədirnəyə gələrək, 16 məhərrəmdə (18 fevral 1451) taxtda əyləşmişdi *(Nəvai, şərhlər, s.480).*

[871] Burada verdiyimiz miladi tarixi yekşənbəyə (bazar gününə) deyil, düşənbəyə (bazar ertəsinə) təsadüf edir.

[872] Qədim əfsanələrin birində dünyanın nəhəng bir öküzün beli üzərində dayandığı zənn edilirdi.

**Rum diyarında baş vermiş hadisələr haqqında söhbət**

Bu il Rum padşahı Sultan Məhəmməd İstanbul valisi Melinus Təkfurun[873] yanına elçi göndərib bildirdi: “Aramızdakı irsi dostluq sazişlər və əhdlərlə möhkəmləndirilmişdir. Bununla belə, boğaz kənarında, Anadolu[874] tərəfdə cüzi bir qala tikmək istəyirik. Ora Rumeli tərəfinə yaxın olsun ki, qalib əsgərlərimiz asanlıqla gəlib keçə bilsinlər. Təkfurun mükəmməl məhəbbət və səmimiyyətinə güvənərək sadəcə bunu xahiş edirik ki, qalanın sığışa biləcəyi qədər ərazini [bizə] güzəştə getsin”.

Bu xəbəri eşidən Təkfur istədi ki, bu xahişi qəbul etməsin və üzrlü bir bəhanə ilə sultana rədd cavabı versin. Həmin vilayətdə Qalata şəhəri[875] firənglərin və Ceneviz (Genuya) hakiminin ixtiyarında idi. Zahirən sultanın istədiyi yer Qalataya yaxın idi. Sultana belə bir cavab verdi: “O məkan mənə aid deyil və Firəng məliklərinin mülklərindəndir. Biz Rum inancında və məzhəbində olduğumuz halda, onların hakimləri Firəng məzhəbindəndirlər[876]. Aramızda həmişə ziddiyyət və dava olubdur. Bu hadisə Firəng məmləkətləri tərəfdən böyük bir fəsada səbəb olacaqdır və onlar heç vəchlə bu istəyi qəbul etməyəcəklər”. Sultan, Təkfurun yalanını, fırıldağını və hiyləsini başa düşdü. Cavab olaraq, yenə də Təkfurdan oranın təslim edilməsini istədi və təkrarən məktub göndərib təvazökarlıqla bildirdi: “Bizim məqsədimiz Təkfurun könül rizasını almaq idi. Bir halda ki ora hansısa bir firəng kişiyə məxsusdur, biz onlara məhəl qoymayacağıq. Bundan sonra qalanın və binanın tikilməsində fəthdən və mübarizədən başqa yol tutmayacağıq”. Həqiqətən də, taleyin yardımı ilə [Bizans imperatoru] bu işə mane olmadı. Sultan öz dediyini edərək cəmi zəfər nişanlı ordusu ilə həmin mətin bünövrə üzərində o məhkəm qalanı tikməyə başladı. Hər gün iyirmi üç min adam onu tikməklə məşğul olurdu. Qırx gecə-gündüz ərzində son dərəcə uca və əzəmətli olan həmin dörd bürclü qalanı tikib qurtardılar[877].

Beyt

“Bu qala ki, şahın ixtirasıdır,
Onun zəkasının qüvvətinə şahiddir.
Cahanın gözü yetərincə dolaşsa da,
Çox şey görsə də, lakin beləsini görməmişdir”.

**Ölümlər**

Bu il Mazandaran hakimi Seyid Məhəmməd ibn Seyid Mürtəza ibn Seyid Əli ibn Seyid Kamal ibn Seyid Qivaməddin vəfat etdi. Oğlu Seyid Əbdülkərim o zaman yüksək məqamlı şah olan Müzəffərəddin Şah Cahanşahın ordusunda idi. O, bu xəbəri eşitdikdə Sariyə gəlib [atasının] yerinə keçdi.

## 857-Cİ İLDƏ (1453) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

**Rum padşahı Sultan Məhəmmədin İstanbul tərəfə qoşun çəkməsi və o diyarı ələ keçirməsi**

Novruz fəslinin əvvəllərində o növcavan sultan səadətli bəxtin yol göstərməsi ilə Qüstəntiniyyənin[878] fəthinə qərar verdiyi və din düşmənlərini qırıb-biçməyə niyyət etdiyi üçün çavuşları[879] Rumeli və Anadolu əsgərlərini çağırmağa göndərdi. Qısa zamanda çoxlu qoşun və saysız güruh ali mənşəli padşahın dərgahına toplaşdı. Onlar sultan üçün qüvvət və bağlılıq kəmərini canlarının ortasına (bellərinə) bağladılar. Qaydası zə-

---

[873] Melinus – Manuil adının təhrif edilmiş forması ola bilər. Lakin II Sultan Məhəmməd zamanında Bizans imperatoru Manuil deyil, Konstantin idi. Manuil isə Osmanlı sultanı I Məhəmməd Çələbi ilə saziş bağlamış Bizans imperatorudur *(Öztürk, şərhlər, 309).* Təkfur – qeyri-müsəlman hökmdarların müsəlman mənbələrində qeyd edilən titulu.

[874] Əslində Rumeli olmalıdır. Çünki İldırım Bayəzid boğazın Anadolu tərəfində daha əvvəl qala inşa etdirmişdi *(Nəvai, şərhlər, s.484).*

[875] Qalata – hazırda İstanbulun bir hissəsidir.

[876] Burada Rum məzhəbi adı altında xristianlığın pravoslav cərəyanı, Firəng məzhəbi adı altında isə katolik cərəyanı nəzərdə tutulmuşdur *(Nəvai, şərhlər, s.484).*

[877] Rumeli (Boğazkəsən) hasarının üç böyük bürcü vardır.

[878] Qüstəntiniyyə - İstanbulun köhnə adı olan Konstantinopolun müsəlman mənbələrindəki adıdır.

[879] Orta əsrlərdə bir neçə mənada işlənmişdir: 1) Hökmdarın gəlməsini elan edərək camaatı yol üzərindən uzaqlaşdıran adam; 2) Hökmdarın əmrini uca səslə elan edən adam; 3) Ordu, karvan və qafilənin yollanmasını uca səslə elan edən qafilə başçısı; 4) Hökmdarın əmr və ya sözünü başqasına çatdıran, başqası üzərində icra edən adam *(H.H.Zərinəzadə. Fars dilində Azərbaycan sözləri, s.272-274).*

fər qazanmaq olan padşah qələbəyə yaxın olan ordu ilə [yola çıxdı] və fələyin qulamlıq etdiyi hökmdar şəvval ayında[880] elə böyük bir izdiham və əzəmətlə İstanbul ətrafına gəldi ki, xəyal nigarxanasında onun misli təsəvvür olunmazdı, düşüncə şahsüvarı iki atla onun atının tozuna yetişməzdi və fikir şahini onun [ordusunun] kəmiyyətini idrak etmək havasında uçmaqdan aciz qalardı.

O şəhərin qalası son dərəcə geniş olub asiman dairələri kimi bir-birini əhatə edən üç paralel hasardan ibarət idi. Onun qüsursuz qala divarlarının şərəfələri[881] fəth kəməndindən amanda və qəsrlərinin otaqları Keyvan eyvanından[882] daha ucada idi. Qara dəniz tərəfdə xəndəyi vardı. Qurudakı dərin xəndəyi isə dünyanın mərkəzinə (nüvəsinə) gedib çatırdı. Belə ki, günəşin qızıl vedrəsi şüa kəndirinin uzunluğuna baxmayaraq, bu əyyamda onun dərin xəndəyindən bir qətrə su çıxara bilməmişdi. Fikir dənizinin dalğıcı heç vaxt bəsirət gözünün dolabı ilə aramsız görmə işığına baxmayaraq, onun dərin çuxurunun dibinə çatmamışdır.

Nəzm

“Demə ki, asimanın qalası ucadır,
Ayın və günəşin kəməndi ona yetişməz.
Xəndəyinin dibi tufan və dalğa dənizidir,
Hasarı dalğanın yuxarı qaldırdığı bir gəmi kimidir.
Küngürəsinin başı fələyə yol tapıb,
Onun lövbəri günəşin və ayın başına dəyib.
Xəndəyinin dərinliyi yerin dibinə çatmış,
Hündürlükdə isə uca göyə yetişmiş.
Qapısı fələk rəvağında bəhrə almış,
Yüksək asimandakı ay ona halqadır.
O möhtəşəm qala o qədər hündür idi ki,
Fələyin qəsrinin bürcü onun yanında torpaq yığını kimi idi.
Qapısı fərəh qapısı kimi bağlı idi,
Kəməndi keçmişdi göy qurşağını”.

Ora böyük bir şəhərdir. Beşinci və altıncı iqlimlərin arasında yerləşir. Onun uzunluq və en dairəsi zic və təqvim kitablarında müəyyəndir. Qədim qeysərlərin boya-başa çatdığı yer və müdrik padşahların paytaxtı olmuşdur. Möhkəm qalası üçbucaq şəklində Əxzəri-Rum (Mərmərə) dənizi sahilində yeddi təpə və düzənlik üzərində qurulmuşdur.

Beyt

“Hasarı və daşı pak cavahirdir,
Yerinin mismarı fələklərin sütunudur”.

O qalanın içini tamamilə abadlaşdırmış və məskunlaşdırmışdılar. Binaların sütunlarını Balıq bürcünün zirvəsinə ucaltmışdılar. Orada elə hündür qəsrlər, bəzəkli və zinətli evlər, asiman kimi yüksək eyvanlar tikmişdilər ki, xəyal mühasibi onun hesabını aparmaqda aciz və naqis olduğunu etiraf edir. O şəhərdə dadlı sular axır.

Beyt

“Onun şirin suyu həyat suyunu qısqandırır,
Yeli isə əbədilik ruhu bəxş edir”.

Xülasə, İstanbul valisi Təkfur Melinus[883] qalanı mühafizə etmək üçün əvvəlki qaydada bütün Firəng məmləkətlərindən və s. kafir firqələrindən saysız-hesabsız qoşun toplayıb darvazaları möhkəmləndirmişdi. Rum qoşunları oranı elə mühasirəyə aldılar ki, düşmənlər əsla kənara çıxa bilmirdilər. Amma oranın iki tərəfi dəniz olduğu üçün o tərəfin zəbt olunması çətin idi. O əsnada hər biri toplu-tüfəngli Firəng qoşunu ilə dolu

---

880 Bu məlumat yanlışdır. Çünki h. 857-ci ilin şəvval ayı m. 1453-cü ilin oktyabr ayına uyğun gəlir. Halbuki İstanbulun fəthi həmin ilin may ayının 29-da baş vermişdir.

881 Şərəfə - məscid minarəsinin azan oxunan eyvanı; qalalarda və s. tikililərdə bürclər, çıxıntılar.

882 Keyvan – Saturn planetini bildirir. “Keyvan” və ya “Keyvan eyvanı” sözləri klassik Şərq ədəbiyyatında ucalıq, yüksəklik rəmzi kimi işlədilmişdir. Orta əsr müsəlman atsronomları Saturn planetinə həm də Zühəl deyirdilər.

883 Bu məlumat yanlışdır. Çünki o zaman Bizans hökmdarı Melinus deyil, Konstantin idi.

olan "gugə"[884] adlı iki böyük gəmi şəhərlilərin köməyinə gəldi. Rum ordusu tərəfdən Süleyman adlı gəmi kapitanı (hakimi-kəşti) onları dəf etməklə məşğul oldu. Amma rumilərin gəmiləri savaş vaxtı firənglərin gəmiləri ilə müqayisədə üfüq dairəsi yanında hilal qövsü kimi idi. Bu səbəbdən o izdihamlı kafirlər özlərini qalanın içinə sala bildilər. Şəhərlilər şad olub sevindilər. Bu hadisə ucbatından rumilərin könlünə tam ruh düşkünlüyü yol tapdı. Sultanın əksər əmirləri mühasirəni tərk etmək barədə vəziri-əzəm Xəlil paşa ilə müttəfiq oldular. Amma Şeyxülislam Ağ Şəmsəddin, Mövlana Əhməd Gurani və Zağanos paşa sülh bağlanmasına razılıq vermədilər. Təcrübə sahiblərinin məsləhəti ilə qərara alındı ki, gəmilərin Firəng tərəfdən gəliş-gediş yolu bağlansın. Dağa bənzər bir neçə gəmini arabaların üzərinə yerləşdirib yelkənlərini açaraq, onları dənizin içindən çıxardılar və Qalata şəhərinin arxasından keçən çölə dartıb, Qalata təpələrinin üzərindən keçirərək qalanın qarşısına çatdırdılar. Sonra gəmiləri yenə də suyun içinə salıb dəniz yolunu da nəzarət altına aldılar. Qalanın ətrafını və yan-yörəsini top-tüfəng atəşinə tutdular. Aramsız olaraq hiddətli və qəzəbli ordunun gurultu və vəlvələsindən, lənətəgəlmiş kafirlərin nalə və fəğanından, tüfənglərin və ağır topların ("qazğan"ların)[885] sədasından yer-göy lərzəyə gəldi.

Beyt

"Kin tüfənglərinin hamısı qızğın və dikbaş,
Onların ucbatından bürclərin hamısı atəş bürcü kimidir".

Təbil və kos avazından, ney və zəng sədasından kafirlər barmaqlarını qulaqlarına tıxadılar. Hamı bir-birinə pıçıltı ilə xəbər verirdi ki, "Onlar qaranlıqda göy gurultusu və şimşəklə səmadan şiddətlə yağan yağışa düşmüş kimsələrə bənzərlər ki, ildırımın səsindən ölmək qorxusu ilə barmaqlarını qulaqlarına tıxayarlar; halbuki Allah kafirləri (öz elmi, qüdrəti ilə) ehtiva edəndir (Onun əlindən əsla qaçıb qurtula bilməzlər)"[886].

Xülasə, əksər bürcləri və qala hasarını dağıtdılar. Ədirnə darvazası tərəfdən də bürclərdə və hasarda çoxlu deşiklər açıldı. Ona görə də Təkfur qala deşikləri üçün Firəng cəngavərlərindən [ibarət] bir dəstəni təyin etdi və şəhərin mühafizəsini o yad camaatın əlinə verdi. Bu iş qala əhlinə ağır gəldi və Təkfura dedilər ki, "təhlükəli yerlərin mühafizəsini yad adamların ümidinə buraxmaq olmaz; bəlkə, bu işin başına bu yerin qədim əhalisinin nümayəndələrini və inanılmış yerli adamları qoymaq lazımdır". Ona görə də firənglər Təkfurdan incidilər və onların ittifaqı nifaqla əvəzləndi.

Sultan Məhəmməd cəmi ordunu öz yanına toplayıb qərar verdi ki, fəthdən sonra üç gün yağmalamaq və qarət davam edəcəkdir. Ertəsi gün səyyarələr padşahı (günəş) qan boyalı xəncərini asimanın gümüşü qınından çəkdi və göy üzünün bir guşəsindən papağını qaldırdı.

Nəzm

"Elə ki sübh üfüqdən fələyin qılıncını çəkdi,
Göyün bütün ətəyini qan bürüdü.
Qaranlıqların atı nalını atdı,
Günəş geyindi ləl qaftanını".

Sultan Məhəmməd cəmi ordu və dərgah mülazimləri ilə ordunun və qoşunun sağından və solundan, mərkəzindən və cinahından igidlərlə və yeniçəri əsgərləri ilə bir anda hücuma keçib qalanın möhkəm hasarına üz qoydular və bir anda qalanı top-tüfəngə tutdular. İlk hasardan qaça-qaça keçdilər. Top-tüfəng zərbəsindən və zərbzən[887] təsirindən kafirlərin rəngi yer həşəratları kimi uçdu. Onlar möhkəm qalanın ən aşağı qatlarında gizləndilər. Amma bir anda top-tüfəng də atdılar. Padşahın ordusu özünü hicran çəkən aşiqlərin ürəyi kimi deşik-deşik olmuş qalanın dəliklərinə yetirdi. Özlərini qalanın içinə salmaq istədilər. Amma Firəng cəngavərləri və bacarıqlı bahadırlar mane oldular. O qövmün sərdarı böyük hasardan çıxıb, hasarçanın üzərinə qalxaraq müharibə və savaş aparmaqla məşğul oldu. Rumilərdən biri divarın aşağısından o yaramazın sinəsinə qılınc vurdu. Elə o saat həmin qorxmaz kafir divarın üzərindən uğursuz qövmün arasına yıxıldı. Ona görə də digər Firəng əsgərləri fərar vadisinə üz qoydular.

---

[884] Avropalıların trireme dedikləri qalera gəmisi *(Nəvai, şərhlər, s.489).*
[885] Qazğan sözü qazan mənasını versə də, bu ifadənin tarixən başqa bir mənası "qala döyən ağır top" olmuşdur *(Nəvai, şərhlər, s.490).*
[886] *Qurani-Kərim, "Bəqərə" surəsi, 19-cu ayə.*
[887] Zərbzən – artilleriyanın bir növüdür.

Beyt

"Onların qoşununun hamısı qorxuya düşdü,
Həlak torpağı ilə yeksan oldular".

Rum ordusu bir anda özünü hasarın üzərindən şəhərin içinə atdı.

Şeir

"Uca hasar ordunun keçidindən,
Kəhkəşan yolu kimi baş yol oldu".

Məhəllə, küçə və bazar içində bəxti dönmüş o qövmlə dava-qırğın etdilər. Axşam vaxtı Firəng dövlətinin və qərb diyarından olan firənglərin tale günəşi uğursuzluq torpağında gizlənməyə başladığı zaman cəngavərlərin qılınc və nizəsinin parıltısı kafirlərin zülmət bədəninə saplandı. Rum qoşunları özlərini məğlub Təkfura yetirdilər. O zaman həmin pis aqibətli idbar Rumeli ordusu ilə vuruşda və döyüşdə idi və qalanın fəthindən xəbərsiz idi. O, bu xəbəri eşitdikdə fərar vadisinə tələsdi. O, dəniz sahilinə yönəldi. Çünki onun qaçışı üçün gəmi hazırlamışdılar. O əsnada qarətlə məşğul olan Rum əzəblərindən bir neçəsi yetişdi. Təkfurun yoldaşları onlara araya alıb, qətlə yetirmək istədilər. Təkfur onların arasında yarımcan halda olan əzəbləri gördü və onları öz əli ilə öldürmək istədi. Lakin atı yıxıldı. Yaralı əzəb ayağa qalxıb cihad qılıncı ilə onun başını kəsdi.

Tale qələmi onun ruzigarının səhifəsi üzərinə zavallılıq hökmünü yazdığı və qərarlaşdırılmış əcəl o rəzilin həyat fərmanını bükdüyü üçün o, ölüm kasasından qılınc qurtumunu uddu və atəş kimi təsir edən iti qılınc küləyindən o külbaşın başı bədənindən ayrı düşdü. Təkfurun qulamlarının hər biri bir tərəfə qaçdı. Sultan üç gecə-gündüz ərzində döyüşçülərin və igidlərin cürbəcür sərvətlər və mallarla dolu olan belə bir şəhərdə ürəkləri istədiyi kimi kişiləri soymasına, qadınları və uşaqları əsir etməsinə imkan verdi. Məxfi qalmasın ki, o zaman həmin şəhərdə o qədər nağd qızıl, cavahirat, nəfis qumaşlar, əmtəələr, əsləhələr, çadırlar, alaçıqlar və digər mallar vardı ki, mahir mühasib onun şərhinin hikmətini xəyal lövhəsi üzərinə yaza bilməzdi. Bu fəth seşənbə günündə, sözügedən ilin rəbiüləvvəl ayında baş verdi[888] və "gözəl şəhər" ("bəldeyi-teyyibə") [ifadəsi] bu fəthin tarixi oldu[889]. Həmin bir neçə gündə aləmi yandıran ordu Qalata qəsəbəsini, Üsküdarı[890], Axyolunu[891] və Silivrini[892] zəbt etdi.

Sultan Məhəmməd tarixçiləri topladı. Onlardan soruşdu ki, "bu şəhəri kim bina etmişdir?". Onlar bu şəhərin tarixi [yazılmış kitabı] Sultan Məhəmmədin yanına gətirdilər. Orada yazılmışdı ki, bu şəhərin banisi İsgəndər Rumidən öncə yaşamış Matiyas oğlu Yanko adlı bir padşahdır. Onun məmləkəti Bolqar və Rus hüdudundan Firəngin və Məğribin ucqarlarına çatır, Səqalib (Slavyan) və Ərmən məmləkətlərindən Əcəm sərhədinə qədər uzanırdı. Onun nəsəbi Ad qövmündən olan Şəddada çatırdı. O, bu şəhəri tikdirməyə başladığı gün şəhəri tikmək üçün qırx min bənna və dörd yüz min fəhlə toplamışdı[893].

Rumi türkcəsindəki tarix əsərində yazılıb ki, [şəhər] tamamlandıqdan sonra Ruqiya adlı bir mütəfəkkir Məğrib diyarından gəlmiş, şəhərə və kilsəyə tamaşa etmişdir. Fikrinə gəldi ki, [burada] bir tilsim qursun. O, qızıldan bir sığırçın düzəltdi, onun ağzına bir zeytun qoydu və qızıldan bir lövhə tərtib etdi. Oraya çoxlu dualar yazdı, o sığırçını lövhəyə qoydu və İsfahandakı sığırçın suyunu (abi-sar) gətirib kilsədən asdı. Ona görə də İsfahandan [buraya] çoxlu sığırçın gəlib Rum diyarının ətrafına səpələndilər. Harada zeytun var idisə, birini dimdikləri, ikisini də caynaqları ilə tutub, qızıl sığırçının qarşısına tökdülər. Hər il zeytun mövsümü gəldikdə o lövhəni qızıl sığırçınla kilsənin üzərinə yerləşdirirdilər və sığırçınlar zeytun gətirib o sığırçının qarşısına atırdılar. Beləliklə, çoxlu zeytun toplanırdı və keşişlərin yaşayışı onunla təmin edilirdi.

---

[888] İstanbul 20 cəmadiyüləvvəl 857 / 29 may 1453-cü ildə fəth edilmişdir. Rəbiüləvvəl ayında isə şəhərin mühasirəsi başlanmışdır *(Nəvai, şərhlər, s.495).*

[889] "Bəldeyi-teyyibə" = 857 h.

[890] Mətndə: Üsküdərə. Əslində isə Üsküdar Fateh tərəfindən deyil, hələ Orxan Qazi zamanında, 1357-ci ildə Osmanlı hakimiyyəti altına keçmişdi *(N.Musalı. Farsça kaynaklara göre Üsküdar'ın tarihi ve coğrafyası // VI. Uluslararası Üsküdar Sempozyumu. II. c. İstanbul, 2009, s.38).*

[891] Axyolu – bügünkü Bolqarıstanın Qara dəniz sahilindəki Pomoriye şəhəri.

[892] Silivri – Türkiyənin İstanbul vilayətinin bir ilçəsi.

[893] İstanbul şəhərinin əsası m.ö. 659-cu ildə Bizas adlı bir nəfərin komandanlığı altında olan meqaralılar tərəfindən qoyulmuşdur *(I.Demirkent. İstanbul // TDVİA, cilt: 23, yıl: 2001, s.205).*

Ruqiyanın bu şəhərdə belə bir tilsim qurduğu haqqında xəbər Məğrib diyarına çatdıqda, Ruqiya ilə dərs yoldaşı olmuş Draqiyus adlı mütəfəkkir da bir tilsim qurmaq istədi. O, bir küp tərtib etdi, onun içini civə ilə doldurdu və qızıldan bir balıq düzəldib civə ilə dolu olan küpün üzərinə qoydu. Dənizin kənarında bir mil qurub o küpü o milin üstünə qoydu. Sonra hər gün o milin qarşısına çoxlu balıq gəlirdi və dayanırdı. Hava isindikcə həmin küp də isinirdi və küpün içindəki civə hərəkətə gəlirdi. Təsadüfən dəniz dalğalanmağa başlayır, balıqlar hoppanıb-sıçrayaraq milin ətrafına tökülürdülər və balıqları satıb onun qiymətini keşişlər arasında bölürdülər.

Üç yüz il sonra zəlzələ səbəbindən bu şəhər xarab oldu və qırx il viran [vəziyyətdə] qaldı. Ondan sonra Matyas oğlu Yankonun nəslindən olan Buzantin Engirüsdən gəlib o şəhəri abadlaşdırdı. Ondan sonra yenə viran oldu. Yenidən Derendu (və ya Drondo) adlı birisi bu şəhəri abadlaşdırdı və ondan sonra qədim zamanlardan bu günlərə kimi bütün Firəngin xilafət mərkəzi olan və Rimi-Pap adlanan Rumiyyeyi-Kübradan (Romadan) Qüstəntin[894] adlı bir padşah çıxıb şərq və şimal məmləkətlərini zəbt etmək iddiası ilə hərəkət etdi və Qüstəntiniyyəni tutub özünə paytaxt etdi. O, orada çoxlu imarətlər tikdirdi və xristian (məsih) dinini qüvvətləndirməyə çalışdı.

Orada ondan çoxlu yadigarlar qalmışdır. Məsələn, indiki At meydanı adı ilə məşhur olan yer onun divanxana məkanı olmuşdur. Onun möhtəşəm sarayının görkəmindən bir neçə mərmər sütun orada qalmışdır[895]. Onun digər bir yadigarı Əzrail kilsəsi adı ilə tanınan kilsədir[896] və başqa bir kilsəni də Yəhya peyğəmbərin adına tikdirmişdir[897].

Onun hakimiyyəti zamanında əksər dövlət ərkanı ali imarətlər tikdirmişlər. Hər kəs öz səviyyəsinə görə möhtəşəm evlər inşa etdirmişdir. Belə ki, indiki əyyamda bəzən onlardan öyrənməklə qəribə tikililər və heyrətamiz nümunələr yaradılır ki, bu da onların iqtidarının və bacarığının çoxluğundan, üstün qabiliyyətlərindən və yüksək çalışqanlığından xəbər verir. Qüstəntiniyyənin binasının qoyulduğu ilk vaxtdan hicri tarixinin 980-cı (14.05.1572 – 02.05.1573) ilə çatdığı indiki zamana qədər cəmi 2411 il keçmişdir.

## Cahanşah padşahın İraqı və Farsı ələ keçirməsi haqqında söhbət

Mirzə Sultan Məhəmmədin qətlindən sonra uğurlu bəxtə sahib olan yüksək məqamlı padşah Müzəffərəddin Cahanşah İraqı ələ keçirmək fikrinə düşdü. Çünki Sultaniyyə Şahsüvar Bayramiyə, Həmədan isə Əlişəkər bəyə məxsus idi və onun İraqa böyük müdaxilə imkanı vardı. O, Diyarbəkrə, Cahangir mirzə ibn Əli bəy ibn Qara Osmanın yanına elçilər göndərdi və onun qızını öz oğlu Məhəmmədi mirzəyə istədi. Cahangir mirzə də öz oğlu Murad bəyi çoxlu töhfələr və hədiyyələrlə ali mənşəli padşahın dərgahına göndərdi.

Cahanşah padşah baharın əvvəllərində miqdarı həddən və hüduddan artıq olan və qeyri-məhdud dəstələri fələk dairəsi kimi sonsuz olan,

Beyt

“Şimşək kimi təsirli, dəniz kimi əngin, külək kimi sürətli,
Zaman qədər uzun, fələk kimi güclü və dağ kimi möhkəm”,

ucsuz-bucaqsız qoşunla və sayı yağış qədər olan ordu ilə Van və Vostan qışlağından çıxıb hərəkət bayrağını İraqa doğru qaldırdı. Sultan Məhəmmədin tərəfindən Dizful və Şüştər valisi olan Əli Məmaş, Pirbudaq mirzənin xidmətinə gedib o şəhərlərin açarlarını təslim etdi. Mirzə Pirbudaq qalibiyyətli ordu ilə Bağdaddan çıxıb atasının ordusuna qoşuldu. Cahanşah padşah onu Əmir Bayəzid Cagirlü, Əmir Şahsüvar, Şahəli Bayrami, Pirzad bəy Buxari, Əmir Əli Nikruz kimi bəzi böyük əmirlərlə və aləmi yandıran digər sərkərdələrlə birlikdə İraqı ələ keçirmək üçün uğurlu bir gündə yola saldı. Mirzənin və əmirlərin hərəkətindən öncə Şahsüvarın mülazimi Aydın qoşunla Savəni ələ keçirmiş və Mirzə Baburun tərəfindən o şəhərin hakimi olan Əmir Şeyxəli Bahadırı dustaq etmişdi. O əsnada başdan-ayağa qədər yaraqlanmış Pirbudaq Qum şəhərini mühasirəyə

[894] 323-337-ci illərdə hakimiyyətdə olmuş Roma imperatoru I Konstantin nəzərdə tutulur. O, 330-cu ildə İstanbulu paytaxt elan etmişdir. Bu şəhər onun adı ilə Konstantinopol adını almış və müsəlman mənbələrində Qüstəntiniyyə kimi yazılmışdır.
[895] Bu, indiki Çemberlitaşdır *(Öztürk, şərhlər, s.316)*.
[896] Bu, Müqəddəs İrena kilsəsi olmalıdır. Bir müddət silah anbarı kimi istifadə olunmuş, 1839-cu ildən etibarən hərbi muzeyə çevrilmişdir *(Nəvai, şərhlər, 496-497)*.
[897] İndiki Miraxur camisi *(Nəvai, şərhlər, s.497)*.

aldı. O şəhərin valisi olan Yusif Xoca oğlu Dərviş Əli Mirək şəhər qapılarını ayıq-sayıq adamlara tapşırıb ox və daş atmağa başladı. Təqribən iki ay Cahanşahın ordusu şəhər ətrafında oturdu. Axırda o məmləkətin başbiləni olan Xoca Yəhya Qumi şəhəri Mirzə Pirbudağa təslim etdi. Dərviş Əli Mirək əsir alınıb zəncirə vuruldu.

Sonra Mirzə Pirbudaq Qumu daruğaya tapşırıb hərəkət bayrağını Cürbadəqan tərəfə yüksəltdi. Xunsardan[898] çoxlu piyada tələb edib onları şəhərlilərin üzərinə qoydu və bir neçə gündən sonra güc və zor yolu ilə o qalanı ələ keçirdi. Mirzə Baburun tərəfindən [orada] daruğa olan Seyid Tirəndaz Şirazini Əmir Pir Məhəmməd Toğayi və bir sıra adlı-sanlı igidlərlə birlikdə qətlə yetirdilər. Oradan çoxlu əsgərlər və sonsuz qoşunla İsfahana yollandılar. O şəhərin əhalisi cağatay ordusunun zəifliyini məlum etdiklərindən Mirzə Baburun onlara göstərdiyi qayğıkeşliyi unudub Rəis Məhəmməd Darakini Mirzə Pirbudağın yanına göndərdilər, bəndəlik və tabeçilik izhar etdilər.

O zaman Əlvənd ibn Qara İsgəndər ibn Qara Yusif Türkman, Əmir Baba Həsən Qarqın, Əmir Şeyx Hacı, Həsən Cəlbəri[899] və Pəhləvan Hüseyn Divanə on min nəfər yaxşı silahlanmış süvari ilə Mirzə Baburun yanından İsfahan camaatını himayə etmək üçün gəldilər və Zindərud sahilində su üstündəki qabarcıqlar kimi alaçıqlar və çadırlar qurub şəhərlilərdən mal və adamla kömək etmələrini istədilər. İsfahan əhli Baburun adamlarından zülm, əziyyət və ədalətsizlik müşahidə etdiyinə görə cağatay əmirlərindən və şəhər daruğasından özlərini uzaq tutub küçələri və məhəllələrin girişlərini möhkəmləndirdilər və Xoca İmadəddin Mahmud Heydərlə ittifaq qurub özlərini tərtibə saldılar və hazır oldular. Babur mirzə Şirazdan İsfahana yönəldi. Cağatay ordusu ümidvar idi ki, Babur mirzə tezliklə onlara birləşəcəkdir. İsfahanlılar da gözləyirdilər ki, türkmanlar tezliklə Cürbadəqan yolundan sürətli yürüş edərək gələcəklər və cağatay qoşununu mühasirəyə alacaqlar. Cağatay əmirləri bundan agah olub, bir gecə türkmanların yaxınlaşdığı haqqında söz yayılarkən öz yüklərini və əşyalarını Şiraza göndərdilər və özləri səhər açılıncayadək at üstündə gözətçilik etdilər. Səhər açıldıqda hamısı birdən şəhər qapısından yola düşdülər. Hüseyn Divanə və Xoca Qiyasəddin şəhərlilərdən aman istəyib qoşuna qatıldılar.

Bu arada Mirzə Babur Şirazdan İsfahana yönəlmiş və Səncər mirzəni Şiraz əyalətinə [hakim] təyin etmişdi. Babur mirzə Qəsri-zərd ətrafında türkmanların hücumu və öz qoşununun məğlubiyyəti xəbərini aldı. O zaman yüyənini İsfahan tərəfdən Xorasana doğru çevirdi. Türkmanlar İsfahana daxil oldular. Bir həftədən sonra Öməşeyx bəyi daruğalığa və Xoca Mahmud Heydəri sərdarlığa təyin edib, Əmir Qütbəddin Vərzənə, Şah Mahmud Xuzani, Əmir Abdulla Babüddəşti, Seyid İmad Gülbari və Şah Mahmud Səfəvi kimi İsfahanın bəzi böyüklərini özləri ilə götürərək Şiraza yönəldilər. Şirazı zəhmətsiz və əziyyətsiz ələ keçirdilər. Cahanşah padşah Azərbaycan hüdudundan İraqa yanaşıb İsfahan əyalətini Xoca Mahmud Heydərə həvalə etdi və hökm göndərdi. Xoca Mahmud hökumət işlərini və sərdarlıq vəzifələrini yerinə yetirməklə məşğul oldu.

Qış bitdikdən sonra [Cahanşah] İsfahanı öz oğlu Məhəmmədi mirzəyə verdi və onun göndərdiyi daruğa Lələ Məhəmməd şəhərə gəldi. Amma Xoca Mahmud Heydər ona iltifat göstərmədi. O isə öz mülazimlik vəzifəsini yerinə yetirdi. O əsnada xoca əbədiyyət aləminə yollandı.

Xocanın ölüm xəbəri Cahanşah padşahın qulağına çatdıqda öz oğlu Məhəmmədi mirzəni İsfahana göndərdi. Şahzadə yetkin yaşa çatmadığından işlərin idarəsi və məsələlərin həlli Lələ Məhəmmədin qardaşı Lələ Səfərşahın ixtiyarında idi. O isə son dərəcə hiyləgər, tədbirli, qantökən və fitnəkar birisi idi. O, isfahanlıları Mirzə Baburla uzlaşmaq və ona qasid göndərmək töhməti ilə ittiham etdi. O, töycü (vergi) işləri bəhanəsi ilə bir dəstə adamı Nəqşi-cahanda[900] toplayıb həbsə aldı və vəziyyətin nə yerdə olduğunu ali taxtın ətəyinə ərz etdi.

O zaman Cahanşah padşah köhnə Xocahəsəndə (Xocahəsəni-mazi) idi. O, qoşunun tuğaçısı[901] olan Seyid Əhməd Tuğçunu qala divarını dağıtmaq üçün İsfahana göndərdi. O, vilayətdən təqribən əlli min beldar və külüngdarı özü ilə aparıb, qala divarını yerlə yeksan edərək hamarladı.

[898] Xunsar (Xansar) – İranın İsfahan vilayətində şəhristan.
[899] Nuruosmaniyyə nüsxəsi: "Əmir Şir Hacı, Həsən Çələbi".
[900] İsfahanda yer adıdır.
[901] Tuğaçı (tuğçu) – bayraqdar.

Bir ay sonra yüksək məqamlı hökmdar Cahanşah padşah şəhərə daxil oldu və həbsdə olan İsfahan böyüklərini əmirlərə tapşırdı. Onların arvad-uşaqlarını isə Azərbaycan qalalarına göndərdi. İsfahanın üzərinə üç min tümən mali-aman[902] qoydu. Amma üç min tümən yerinə on min tümən aldılar. Bir misqal qızıl yüz İraq dinarına bərabər olsa da, onu əlli dinardan hesabladılar. Hər biri on dinar qiymətə malik olan cavahirat, qadın paltarları və bəzək əşyaları bir dinardan hesablandı. Axırda isə İsfahanda qətliam törətdilər.

Cahanşah padşah sayı ulduzlardan çox olan ordu ilə Qum şəhərinə yönəlib orada qışlaq etdi. Baharın əvvəllərində gecə-gündüz bərabərliyi zamanı çoxlu ordu ilə Savuxbulaq tərəfə yola düşdü. Nifaq əhlinin ucbatından, hökmdarın Azərbaycana getdiyini güman edən İraq camaatı müxaliflik etməyə başladı. Mirzə Babur da eşitdi ki, türkman qoşunları İraqı və Farsı qoyub getmişlər. Ona görə də Mirzə Səncəri bəla əlamətli ordu ilə Kirmana yolladı. Cağatay daruğası qorxusuz-hürküsüz İzədxast[903] qalasına çatdıqda, İsfahandan fərar etmiş və həmin qalaya sığınmış Seyid Mir Əli Gülbarın oğlu Seyid Mir Cəlal İsfahana gəldi. Əsillikcənəsillikcə məmləkətin dini öndəri olan Xoca Zəhirəddin Abdullanın nəvəsi Xoca İmaməddin Həsən şəhər camaatını üsyana təhrik etdi. Ona görə də şəhər daruğası Hacı Taromini[904] qətlə yetirdilər və onun əsgərlərini həbsə alıb şəhərin qala divarlarını möhkəmlətməklə məşğul oldular. Vəziyyəti bildirmək üçün Xorasana, Mirzə Baburun yanına yamçı (qasid) göndərdilər.

Ona görə də Mirzə Babur İraqa yönəldi və sonra Sultan Əbu-Səidin müxalifliyi üzündən yenə geri dönməli oldu.

Elə ki bu möhnətli xəbər yüksək məqamlı hökmdar Şah Müzəffərəddin Cahanşaha çatdı, Məhəmmədi mirzəni çoxsaylı ordu ilə İsfahan camaatını qırıb-biçməyə göndərdi. Türkman qoşunları o cənnət nişanlı şəhəri ələ keçirdilər. Fitnə dalğaları möhnət sellərinə qarışdı. Kiçiyi və böyüyü, qocanı və cavanı qətlə yetirdilər.

“Asiman İsfahandan çıxardı tüstü,
Orada Zində-ruddan başqa diri heç nə qalmadı”.

**Mirzə Baburun Xorasan tərəfə hərəkəti və zamanın hadisələrindən və dövranın dəyişikliklərindən bəziləri**

Mirzə Babur türkman ordusunun hərəkəti xəbərini eşitdi, Şiraz hakimliyini Mirzə Səncərə[905] və Yəzd əyalətini Mirzə Xəlilə[906] həvalə etdi. Özü isə növrəstə bahadırlarla və tərtib olunmuş ordu ilə döyüşə və vuruşa yollandı. Yol əsnasında Heratdan elçi gəlib ərz etdi ki, Mirzə Əlaüddövlə, Əmir Yadigarşah Orlatın oğlu Əmir Cəlaləddin Sultan Mahmudun[907] yardımı ilə qiyam qaldırmış və Xorasanı ələ keçirmişdir. Ona görə də cahan hökmdarı rəcəb [ayının] 16-da (23.07.1453) Köşki-zərdən Xorasan tərəfə hərəkət etdi.

Mirzə Əlaüddövlənin qiyamının şərhi belədir ki, onun gözünə mil çəkdikləri zaman Məşhədə gəlib orada mücavir[908] oldu. Oradan özünü Mürğab, Meymənə[909] və Faryab[910] tərəfə yetirdi. Əmir Yadigarşah Orlatın oğlu Əmir Cəlaləddin Sultan Mahmud və b. sərdarlar ona qoşuldular. Mirzə Əlaüddövlə onların varlığı ilə güc qazanıb Bəlxə yola düşdü. Əmir Pir Dərvişə və Əmir Əli Həzarəsbiyə məğlub olub Herata yönəldi. Bu əsnada Əmir Üveys Tərxan Fərahdan, Əmir Pir Dərviş Bəlxdən və Əmir Xəlil Mərv tərəfdən onun üzərinə gəldilər. Mirzə Əlaüddövlə can qorxusundan Sistan tərəfə qaçdı və bir müddət o çöllükdə heyran və sərgərdan gəzdi. Axırda üfüqlər hökmdarının qorxusundan İraqa yollandı və Reydə Cahanşahın ordusuna gəlib onun tərəfindən qəbul edildi.

---

[902] Mali-aman – müharibələr zamanı işğalçı ordunun hər hansı bir yaşayış məntəqəsini qırğına və qarətə məruz qoymamaq üçün oranın əhalisindən aldığı vergi.
[903] İzədxast (və ya Yəzdxas) – İranın Fars vilayətində, İsfahanla Şiraz arasında yerləşir.
[904] Paris nüsxəsi: “Sultan Buxari”; Nuruosmaniyyə nüsxəsi: “Xoca Sultan Taromi”.
[905] Mirzə Səncər ibn Əmirək Əhməd ibn Ömərşeyx ibn Əmir Teymur *(Nəvai, şərhlər, s.503).*
[906] Mirzə Xəlil, Şahruxun nəvəsi (qızının oğlu) idi. Atası isə Mirzə Məhəmməd Cahangir ibn Mirzə Məhəmməd sultan ibn Mirzə Cahangir ibn Əmir Teymur idi *(Nəvai, şərhlər, s.503).*
[907] Əmir Cəlaləddin Sultan Mahmud – Mirzə Əlaüddövlənin qaynı idi *(Nəvai, şərhlər, s.503).*
[908] Mücavir – məqbərə xidmətçisi.
[909] Meymənə – müasir Əfqanıstanda, Heratla Bəlx arasında yerləşən şəhər.
[910] Faryab (Fəryab) – Əfqanıstanda, Meymənə şəhərindən şimaldakı Dövlətabad şəhərinin ərazisində yerləşmiş orta əsr qalası.

### Mirzə Pirbudağın Şirazı ələ keçirməsi haqqında söhbət

Mirzə Babur Xorasana yönəldikdən sonra Mirzə Xəlil Yəzddən Şiraza doğru hərəkət bayrağını qaldırdı. Mirzə Səncər müqavimət göstərməyə tab gətirməyib bir dəstə inanılmış adamı ilə birlikdə Kirman tərəfə fərar etdi. O diyarın ətrafına çatdıqda, əvvəlcə Mirzə Sultan Məhəmmədin tərəfindən o məmləkətin valisi olan, onun qətlindən sonra isə tam müstəqillik əldə edən Seyid Şirvani şahzadəni Kirmana buraxmadı. Mirzə Səncər o tərəfdən Xorasana yola düşdü. Mirzə Səncərin getməsindən sonra Mirzə Xəlil darüssəltənə Şiraza gəldi. Bu əsnada Mirzə Pirbudaq İraq yolundan Şiraz ətrafına çatdı. Mirzə Xəlil Kirman yolundan Xorasan tərəfə qaçdı. Mirzə Pirbudaq tamamilə təmtəraqla və zəmanə çətinliklərindən zəhmətsiz bir şəkildə Şiraz məmləkətini ələ keçirdi. O, böyük əmirlər Əmir Bayəzid Bistam, Əmir Şahəli Bayrami və Pirzad bəy Buxarini atasının hüzuruna göndərdi və Şirazın zəbtindən sonra atası ilə görüşmək üçün Quma getdi.

### Ölümlər

Daha öncə qeyd edildiyi kimi, Melinus Təkfur bu il Sultan Məhəmmədin qoşununun əli ilə öldürüldü. Onun qətli ucbatından, Ali-Əsfər deyilən Rum qeysərləri dövlətinə son qoyuldu. Bu təbəqədən qırx yeddi nəfər bu təfsilatla səltənət sürmüşlər:

Herakl[911], Konstantin[912], Herakl[913], Konstans[914], Yustinius[915], Leon[916], Tiberius[917], Ağustos[918], Anastas[919], Leontianus[920], Madaris[921], Leon[922], Corcis[923], Konstantin[924], Leon[925], Nisefor[926], Estiraq[927], Mixail[928], Zenon[929], Toefil[930], Tüdora[931], Mixail[932], Teofil (?), Basil[933], Leon[934], İsgəndərus[935], Konstantin[936], Armanus[937], Mixail[938], Aleksis[939], Yuhənna[940], Milinus[941].

Yuhənna ilə Milinus arasında bir neçə nəfər digərləri də vardır ki, İstanbulda səltənət sürmüşlər. Onların hakimiyyətlərinin müddəti təqribən səkkiz yüz səkkiz ilə çatmışdır[942].

---

911 I İrakli (610-641).
912 III Konstantin (641).
913 II İrakli (641).
914 II Konstant (641-668).
915 II Yustinian (685-695 və 705-711).
916 Leonti (695-698).
917 III Tiveri (698-705).
918 Bizans imperatorları arasında Avqust adlı bir çox hökmdarlar olmuşdur. Amma təqdim olunan ardıcıllıq əsasında diqqət etdiyimiz zaman həmin illərdə bu adda imperatorun olmadığını görürük.
919 II Anastasi (713-715).
920 Xronoloji ardıcıllığı nəzərə alsaq, həmin illərdə bu adda hökmdar olmamışdır.
921 Feodosi (715-717).
922 III Lev İsavr (717-741).
923 Bu adda Bizans imperatoru olmamışdır.
924 V Konstantin (741-775).
925 IV Lev Xazar (775-780).
926 I Nikifor (802-811).
927 Stavraki (811).
928 I Mixail Ranqave (811-813) və ya II Mixail Travl (820-829).
929 Zenon adlı imperator 474-491-ci illərdə hakimiyyətdə olmuşdur. Lakin onun adının burada çəkilməsi xronoloji ardıcıllığı pozur.
930 Feofil (829-842).
931 Feodora – 842-856-cı illərdə oğlu III Mixailin əvəzinə dövləti idarə etmişdir.
932 III Mixail (842-867).
933 I Vasili (867-886).
934 VI Lev (886-912).
935 Aleksandr (912-913).
936 VII Konstantin (913-959).
937 II Roman (959-963) və ya III Roman (1028-1034).
938 IV Mixail (1034-1041), V Mixail (1041-1042), VI Mixail (1056-1057) və ya VII Mixail (1071-1078).
939 I Aleksey Komnen (1081-1118).
940 II İohann Komnen (1118-1043).
941 II Manuil Paleoloq (1391-1425).
942 Bizans imperiyası 395-1453-cü illərdə mövcud olmuşdur. Bizansın son imperatoru XI Konstantin Draqaşdır (1449-1453). Burada təqdim olunmuş Bizans imperatorlarının siyahısı natamam və qüsurludur. Ə.Nəvainin şərhinə (s.506) görə, Həsən bəy Rumlu bu məlumatları Qazı Əhməd Qəffarinin “Tarixi-cahanara” əsərindən götürmüşdür. Bizans imperatorları haqqında daha ətraflı məlumat üçün bax: *С.Б.Дашков. Императоры Византии. Москва, 1996.*

Əmir Şahi – adı Ağ Məlik ibn Cəmaləddindir. Nəsəbi Sərbədarlara[943] çatır. Bir gün Mirzə Baysunqur ona dedi ki, gərək [özünə] başqa bir təxəllüs seçəsən və bu təxəllüsü onunla dəyişəsən. Əmir Şahi qəbul etmədi. Bir gün Əmir Şahi bir sıra dostları ilə şahzadənin dərgahına getdi. Mirzə Baysunqur onları çağırdı. Əmir Şahi bayırda qaldı. Bu qəzəli deyib o həzrətin yanına göndərdi:

Qəzəl

“Ey əyləncə məclisində ardıcıl qədəh vuran,
Könül qanı içmədən necə aşıqlikdən dəm vurursan?!
Heyf o naza ki, nemət əhlinə göstərirsən,
Zay olsun o ox ki, onu qəmsiz ürəklərə vurursan.
Oyandır naz yuxusundan o şəhla nərgizi ki,
Ömür keçir gülün ömrü kimi, bir göz qırpımında.
Zülfünü açırsan və ürəkləri qarət edirsən,
Çöhrəni göstərirsən və aləmə atəş vurursan.
Bu qapıdan məhrum edirsən acız Şahini,
Rədd əlini məhrəm dostların sinəsi üzərinə qoyursan”.

Əmir Şahi cəmi heysiyyətləri özündə toplamışdı. O cümlədən yaxşı ud çalırdı, gözəl xətlə yazırdı və həmçinin əla müsəvvir (rəssam) idi. Öz həyatı müddətində nəzm sapına təxminən on iki min beyt düzmüşdü. O cümlədən onun min beyti indi də şairlər arasında məşhurdur. Həmin beytlərdən divan bağlamış, qalanlarını isə silib atmışdır. Bu il o, Astarabad vilayətində əbədiyyət aləminə yola düşdü.

Ömrünün müddəti yetmişi adlamışdı. Onun cəsədini Səbzəvara aparıb əcdadlarının yanında dəfn etdilər. Xoca Əvhədi Səbzəvari o söz ustadlığı meydanının süvarisi haqqında bir mərsiyə demişdir:

Beyt

“Göz yaşımdan və ahımdan qoy alt-üst olsun Səbzəvar,
Ondan ötrü ki, şah şəhəri Şahi olmadan bir işə yaramaz”.

## 858-Cİ İLDƏ (1454) BAŞ VERMİŞ HADİSƏLƏR

### Rum padşahı Sultan Məhəmmədin Las məmləkəti tərəfə qoşun çəkməsi və Sivrihisar qalasının fəthi

Sultan Muradın vəfatından sonra Las vilayətinin hakimi Vilkoğlu[944] eşitdi ki, Sultan Murad cahandarlıq taxtını tərk edib torpağın altına köçmüşdür. Buna görə də onun ağlına pis xəyallar gəldi. O, ayağını öz həddindən kənara qoyub qarət və tarac etməyə başladı və aqibətinin təhlükəli olacağından, nankorluğun uğursuzluq gətirəcəyindən çəkinmədi. O, pis əməl ağacının səmərəsinin və cəfakarlıq toxumunun bitkisinin nə olduğundan xəbərsiz idi.

Şeir

“Şadlıq zamanında bir ağac əkmə ki,
Ruzigar ondan zəhər barı yetirəcək.
Hər kimsə cəfa toxumu əkdisə,
Nə xoş gün tapar, nə də ki şad behişt”.

Sonra onun fitnə-fəsadı mötədil həddi keçdi. Lütf və sərtlik, tənbeh və təhdid, vədlər və xəbərdarlıqlar ona təsir göstərmədi. Ona görə də Sultan Məhəmməd onun fitnə alovunu söndürmək və onun yaramazlıqlarını aradan qaldırmaq üçün cihad kəmərini bağlayıb, baharın əvvəllərində yağış damlalarından daha artıq sayda olan saysız-hesabsız bir ordu ilə o bədkirdar kafirlərin üzərinə getdi. Sultanın gəlişindən xəbərdar olan Vilkoğlu izdihamlı qoşunların qorxusundan öz məmləkətinin sərvətlərini, bütün yüklərini və mallarını möhkəm Sivrihisar qalasında[945] qoydu və Semendire qalasını da möhkəmlətdi. O namussuz kafir, Engirüs diyarına tərəf fərar etdi.

---

[943] Sərbədarlar – xalq hərəkatı nəticəsində yaranmış və 1337-1381-ci illərdə Xorasanda hökm sürmüş şiə səltənəti *(И.П.Петрушевский. Ислам в Иране, с.353-357).*

[944] Serbiya hökmdarı Georgi Brankoviç (1427-1456). Atasının adı Vuk Brankoviç idi.

[945] Sivrihisar (Sivricəhisar) – Serbiyanın Rudnik şəhəri yaxınlığındakı Ostrvitsa qalası nəzərdə tutulur.

İzdihamlı qoşunlar Sivrihisarı bir mərkəz kimi dövrəyə aldılar. Sultan ordusunun əksəri soyğun və qarət etməyə, vilayəti dağıtmağa yollandılar. Belə ki, yeniçəri camaatından savayı, [sultanın] yanında heç kim qalmadı. Qalanı müdafiə edən kafirlər izdihamlı ordunun az qisminin qaldığını müşahidə etdikdə, bir anda Sivrihisardan çıxıb onlara həmlə etdilər və bir sıra rumiləri gedər-gəlməzə göndərdilər. Sultan öz nəfis vücudu ilə bir dəstə igidlə düşmənlərə həmlə etdi və onları məğlub edib şəhərin darvazasına qədər qovdu. Həmin zaman adət-ənənəyə görə əsgərlərə tarac izni verdi.

Şeir

“Qarəti eşitdikdə cavan və qoca,
Hamısı sinələrini etdilər oxa hədəf”.

Bir gündə o qalanı ələ keçirdilər. Amul[946] qalası da asanlıqla fəth edildi. Sonra hər qalaya hökmləri icra etmək üçün hakim, zabit və qazı təyin edildi. O sərhədin və ölkənin əhvalı xeyirxahlığın hüsnünün və qayğıkeşliyin lütfünün zivəri ilə bəzəndi, seçkin və sadə insanların rifahı təmin olundu və əmin-amanlıq kölgəsi göründü. Ondan sonra [dünyanın insanla] məskun dörddə bir hissəsinin hökmdarı səadətli tale və xoş bəxtlə geri döndü. Bu yürüşdə Mahmud paşa layiqli xidmətkarlıq və müvafiq tədbirlər həyata keçirdiyi üçün o, xas bəndələrdən fərqləndirildi və vəzir mənsəbi ona həvalə edildi. Ədirnədən qayıtdıqdan sonra [sultan] şəhər (İstanbul) kənarında ali bir mənzil bina etdi.

**Xorasan diyarında baş vermiş hadisələr**

Mirzə Babur bu il yenidən İraq və Azərbaycanı fəth etmək və türkman hökmdarı Cahanşah padşahdan intiqam almaq xəyalına düşdü. Yol əsnasında Mirzə Səncəri çoxlu ordu ilə Kirmana göndərdi. Xəbuşanın Yalquzağac mövqeyi zəfər nişanlı qoşunların çadırlarının qurulduğu yerə çevrildikdə Mirzə Xəlil sultanın[947] yaxınlarından biri ali [hökmdarın] qulağına çatdırdı ki, şahzadə bir sıra pis niyyətlilərlə ittifaq etmişdir və onlar qiyam etmək fikrindədirlər. Günahı sübuta yetdikdən sonra Mirzə Xəlil sultan və onun tabeçiləri ramazan ayında (25.08-23.09.1454) o biri dünyaya göndərildilər.

Ali məqamlı hökmdar oruclu ayını orada keçirib, şəvvalın (24.09-22.10.1454) əvvəllərində səadət və uğurla hərəkətə gəldi. Zilqədə [ayının] 15-də (06.11.1454) Astarabadın Sultanabad [adlı yeri] dindar və ədalətli sultanın düşərgəsinə çevrildi. O qış Cürcan vilayətindən elçi gəlib ərz etdi ki, Sultan Əbu-Səid Ceyhundan keçmiş, Əmir Pir Dərvişi və qardaşı Əmir Əlini qətlə yetirmiş və Bəlxdə yerləşmişdir. Mirzə Babur bu xəbəri eşitdikdə, bu fitnəni dəf etməyi İraqı ələ keçirməkdən daha mühüm hesab edib Mavəraünnəhrə yola düşdü. Heratın şimal tərəfindən şimal küləyi kimi keçib Badğis vilayətinə daxil oldu. Xoca Vəcihəddin Simnani və b. əyan-əşrəflər onun hüzuruna gəldilər və yığılıb qalmış vergilərin hamısını nağd şəkildə ödədilər. O məbləğin hamısı əmirlərə bağışlandı.

Bu əsnada ali [hökmdarın] qulağına çatdı ki, Mirzə Əlaüddövlənin Bəlxdən Herata gəldiyi zaman onun yanında çoxlu cavahirat varmış və o, bunları bir yerdə[948] basdırmışdır. Əmirlər axtarış aparıb Bədəxşan ləllərini, qırmızı yaqutları, parlaq zümrüdləri və şahanə inciləri o tac bəxş edən hökmdarın məclisinə gətirdilər. O, laqeydlik göstərərək bunlara gözünün ucu ilə də baxmadı, bunların arvadlar üçün münasib olduğunu buyurdu və öz yaxınlarına[949] bağışladı.

Mürğab çayından keçdikdən sonra Bəlx tərəfdən xəbər gəldi ki, Sultan Əbu-Səid Amudərya çayından keçmişdir və öz paytaxtına (darülmülkünə) getmişdir. Mirzə Babur tələsirdi və Ceyhundan gəmisiz keçmək çətin idi. Ona görə də tədbirli padşah Ərhəngdən[950] keçdi.

Şeir

“Ceyhun çayı mane ola bilmədi,
Timsahlar su üstündən keçdilər.

[946] Yəqin ki, bu, Belqrad yaxınlığındakı Avala (Zrnov) qalasıdır.
[947] Mirzə Xəlil sultan ibn Mirzə Məhəmməd Cahangir ibn Mirzə Məhəmməd sultan ibn Mirzə Cahangir ibn Əmir Teymur *(Nəvai, şərhlər, s.512).*Sonrakı abzasda zilqədə ayının qeyd olunması bu fəslin ümumi xronoli ardıcıllığı pozur.
[948] Paris nüsxəsi: “bir quyuda”.
[949] Paris nüsxəsi: “özünə məhrəm olan qadınlara”.
[950] Ərhəng – Bədəxşanda bir qəsəbədir.

Yerindən oynadı aləm o kin selindən,
Lərzəyə gəldi Turan torpağı”.

O zaman Mirzə Baburun mülazimləri Sultan Əbu-Səidin böyük əmirlərindən olan Əmir Pir Sultan Barlası və Əmir Əhmədyarı tutub gətirdilər. Əmir Pir Sultan, Mirzə Babur tərəfindən yaxşı qarşılandı. O, ali divanda bütün əmirlərdən daha öncə möhür vurdu (digər əmirlərdən daha üstün bir səviyyəyə yüksəldi). O əsnada Bədəxşan şahının oğlu bol peşkəşlə dərgaha gəlib hörmətlə qəbul edildi və o həzrətin icazəsi ilə öz diyarına geri qayıtdı. Tac bəxş edən padşah Vəxş çayından[951] keçib Hisar (Hisari-Şadman) vilayətinə daxil oldu. Nəvandak[952] mövqeyində Xoca Nizaməddin Məvdud və Mövlana Fəthulla Təbrizi elçi kimi hökmdarın ordusuna gəldilər və sülhdən söz saldılar. Mövlana Fəthulla dedi:

- Sultan Əbu-Səid mənə and verib ki, bu sözləri sizə deyim. O söyləyir ki, mən keçə geyərək bu vilayəti tutmuşam və onu asanlıqla verməyəcəyəm.

Əmirlər kobud sözlər deyib elçiləri həbsə aldılar və köç etdilər.

Şəvval [ayının] 14-də (06.10.1454) yaxşı əməlli hökmdar səadət və uğurla Səmərqəndin bir fərsəxliyindəki Həşərtu[953] kəndində dayandı. O tərəfdən Sultan Əbu-Səid Bəlx səfərindən geri döndükdən sonra qoşuna izin verib bir neçə nəfərlə Səmərqənddə yerləşmişdi. Xəbər gəldi ki, Mirzə Babur cəsur igidlərlə böyük çayları gəmisiz adlayaraq köçə-köçə [buraya] gəlir. Sultan Əbu-Səid mülazimlərə izin verdiyi üçün iztiraba düşdü. Çünki qoşunlar qısa bir zamanda izin alıb öz diyarlarına getmişdilər və onların geri dönməsi müşkül idi. Sonra səmərqəndlilər ərz etdilər ki, biz şəhəri bir il qoruyarıq. Sultan Əbu-Səid istəyirdi ki, Türküstan tərəfə getsin. Amma bu hərəkətdən vaz keçib şəhərdə müdafiə olunmağa qərar verdi və hökm etdi ki, rəiyyət arasında daha artıq qüvvəsi olan hər kəs şəhərə gəlsin, qalanları isə möhkəm yerlərə getsinlər. Buyurdu ki, qalanın və hasarın hər bürcündə biri türk və ikisi tacik olmaqla üç nəfər yerləşsin və hər bürcə su küpü, qaynar yağ kuzəsi və çoxlu odun hazır edilsin ki, qırğın atəşi alovlanan vaxt qızmar yağı və qaynar suyu düşmənlərin başına töksünlər. Hər iki bürcün arasında bir sandıq möhkəmlətsinlər ki, onun içində oturub ox atmaq mümkün olsun. Qala divarları üzərində qucağa sığmayan qüvvətli şalbanları kəndirlə bağladılar ki, savaş vaxtı onları düşmənlərin başlarına salsınlar. Bürclərdən keçələr asdılar ki, düşmənlərin atdıqları hər bir oxu şəhərlilər ələ keçirsinlər. Hər bürcə bir daruğa təyin olunmuşdu ki, işləri ehtiyatla həyata keçirsin və hər bürcdə bir məşəl yandırdılar.

Mirzə Babur Həşərtu kəndində dayandıqda, əmirlər arasında bahadırlıq mübahisəsi düşdü. Ona görə də Əmir Xəlil Hindukə, Əhməd Yasavul, Seyid Piyada və Qədəm Kabili kin qılıncını bellərindən sıyırıb Səmərqənd darvazasına həmlə etdilər və şeypur çaldılar. Mavəraünnəhrin Bəhram kimi qəhredici qoşunu şəhərdən çıxıb həmlə etdi və Misri qılıncın ucu ilə meydanın səthini qanla doyuzdurdu. Hindi xəncərin qurtumu ilə döyüş meydanının torpağını məst etdilər. Hər iki tərəfdən bir çoxları həlak torpağı üzərinə düşdülər.

Beyt

“Hər iki güruhdan çox adam öldü,
Qandan dəniz qabardı və ölüdən dağ yarandı”.

Xeyli savaşdıqdan sonra Mirzə Baburun qoşunu fərar yolunu tutdu. Əmir Xəlil Hindukə və Əmir Əhməd Yasavul əsir tutuldular. Mirzə Baburun qoşunu keçilməsi çətin yollardan getdiyi üçün onlardan bir çoxları qətlə yetirildilər. Sultan Əbu-Səid əsirləri tələb edib, Əmir Xəlil Hindukədən soruşdu ki, “nə üçün öz hörmətini saxlamadın?”. Və buyurdu ki, onu ayrı bir yerdə saxlasınlar. Əmir Əhməd Yasavul cürət edib dedi ki, “bəlkə, biz əsirlərin vasitəsilə siz qardaşlar arasında sülh olar”. Bu söz sultanın xoşuna gəldi və hamısına hörmət göstərdi.

Bu xəbər Mirzə Babura çatdıqda köç edib Eydgahda (“bayram yeri”) saray pərdəsini və bargahını günəşin və ayın zirvəsinə ucaltdı. Piyadalardan və süvarilərdən [ibarət] çoxsaylı bir dəstə bir anda şəhərdən çıxdı və Pəhləvan Hüseyn Divanə onlarla ağır bir döyüş apardı.

Şeir

“Bu mavi çənbərin (asimanın) zülfü,

[951] Tacikistanda çay.
[952] Bu yerin adı “Mətləüs-səadeyn”də Undak, “Həbibüs-siyərdə” isə Tundak şəklində yazılmışdır *(Nəvai, şərhlər, s.514).*
[953] “Mətləüs-səadeyn”də Həşəriv yazılmışdır *(Nəvai, şərhlər, s.514).*

Gündüzün üzünə ənbər tökən vaxt.
O hər iki ordu bir-birindən ayrıldı,
Yataq yerini döyüş meydanından üstün tutdular”.

Mirzə Əbülqasım Babur səflər çəkib şeypur çaldırdı və buyurdu ki, şəhərin qarşısında, qoşunun önündə xəndək qazıyıb öz yerlərini möhkəmlətsinlər. Gecə düşdükdə, hər iki tərəf gözətçi dəstəsi təyin etdi və sabaha qədər növbə çəkdilər.

Sonra ertəsi gün şəhər camaatı Çaharrahə (Dördyol) darvazasından çıxdı və Şəmsəddin Məhəmməd Xudadadın qarşısında səf çəkdi. Bu əsnada Xorasan qoşunu fərar etməyə üz qoydu və çuxurlarda süvarilər və piyadalar bir-birinin üstünə yıxılıb yoxluq girdabına qərq oldular. Mirzə Babur bir dəstə igidi o tərəfə yolladı. Onlar səmərqəndliləri dəf edib onların ələ keçirdikləri qənimətləri geri aldılar. Ertəsi gün də bir dəstə Şeyxzadə darvazasından çıxdı. Əmir Şir Hacı və Əmir Şeyx Əbu-Səid onların qarşısına getdilər və gecəyədək onlarla vuruşdular.

Ertəsi gün günəşin çeşməsi sübh üfüqündən doğduqda, Xorasan ordusu yenidən döyüşə atılıb dəmir qapıya qədər gəldi. Qəflətən dəmir qapı açıldı və aslan kimi güclü, fil kimi cüssəli qoşun başdan ayağa kimi dəmirə və polada qərq olmuş halda [oradan] çıxdı. Hər iki tərəf çoşub hay-küy saldı. Gecə düşdükdə hər iki qoşun yorulub yüyənlərini geri çevirdilər və öz mənzillərinə və məskənlərinə tələsdilər. Dəmir qapının qarşısında dayanmış Əmir Həsən bir dəstə nəqəbçiyə (lağımçıya) buyurdu ki, Tuman ağa xanəgahının içindən lağım vursunlar. Lakin şəhərlilər [bundan] agah olduqları üçün onlar bir iş görə bilmədilər.

Bu günlərdə soyuq qoşununun ön dəstələri gəlib özlərini yetirdilər və üç dəfə çoxlu qar yağdı. Havanın soyuqluğu o dərəcəyə çatdı ki, bədən əzaları ixtiyarsız qalıb, iş görə bilməyəcək hala düşdü. Səmərqəndin soyuğu şöhrət tapmasına baxmayaraq, həmin vaxt o, öz ənənəvi həddini aşmışdı. Bu yürüşdə Mirzə Baburun qoşunundan təqribən yüz min dəvə tələf oldu. Səmərqəndin ətrafında taxıl qalmadığı üçün Mirzə Baburun adamları beş-altı fərsəx uzağa gedib taxıl gətirirdilər. Şəhər camaatı onların ardınca gedib, hər kimi gördülərsə, o biri dünyaya göndərdilər. Bəzilərinin isə qulaqlarını və burnunu kəsib orduya yolladılar. Mirzə Babur agah olub bir dəstə bahadırı təyin etdi ki, yasaqçılar və əsgərlər hansı tərəfə gedərlərsə, əmirlər və bahadırlar onlardan xəbərdar olsunlar. Sonra Əmir Üveys Tərxan və Əmir Sultan Hüseyn yola düşdülər. Şəhər əhli xəbər tutub bir dəstə igidi [şəhərdən] bayıra göndərdilər. Mirzə Babura düşmənin hərəkəti barədə məlumat verdilər. Mirzə Babur buyurdu ki, Mirzə İsgəndər Türkmanın oğlu Əmirzadə Əlvənd[954], Əmir Əbülhəsən Tərxan, Əmir Hüseynəli və Əmir Bəhlul hərəkətə gəlsinlər. Şəhər camaatı Üveys Tərxana və digər yüksək şanlı əmirlərə çata bilmədi və onların ardınca göndərilmiş əmirlərlə qarşılaşdı. Hər iki tərəf igidlik və şücaət göstərib, atəş yağdıran oxun yarası və iti qılıncın zərbəsi ilə neçə-neçə adamı yerə sərdilər. Çoxlu çalışvuruşdan sonra xorasanlı igidlər qalib gəlib bir çoxlarını əsir və dustaq etdilər. O cümlədən Əmir Əbdüləli Tərxanı və Əmir Əhməd Fazili tutub Mirzə Baburun dərgahına gətirdilər. O döyüşdə şücaət nümunələri göstərmiş igidlərdən biri Əmirzadə Əlvənd idi. Əbülhəsən Tərxan da çox rəşadət göstərmişdi. Əmir Hüseynəli Candar döyüş meydanında ayağını mətanət və qətiyyətlə yerə basıb, qarşısına gələn dəstəni qantökən qılıncın zərbəsi və fitnə salan nizənin ucu ilə qəhr etmiş və əsir almışdı.

Əmirzadə Əlvənd hadisəni necə görmüşdüsə, eləcə də Mirzə Baburun məclisində ərz etdi. Bəhlul Candar [əvvəllər] çoxlu qələbə qazanmasına baxmayaraq, [bu dəfə] bir iş görə bilməmiş və günahkar vəzəyyətə düşmüşdü. O, qəflətən ali bargahda Əmirzadə Əlvəndə hücum çəkib, kobud sözlər söyləyərək oradan çıxdı. Bu əsnada Şimal bağı[955] tərəfindən qalmaqal və hay-küy qalxdı. Bahadırlar təcili surətdə [oraya] getdilər. O rəzil bu bəhanə ilə ata minib özünü Səmərqənd şəhərinə yetirdi. Onun kiçik qardaşı Əmir Eyyub darvazaya qədər getsə də, ondan üz döndərib öz mənzilinə geri qayıtdı. Zərif [şeirlər deyən] şairlərdən biri Bəhlul haqqında əlahəzrətə xitabən dedi:

“Sənin oxun düşmənlərin gözünə mildir,
Sənin meydanında piyada da fil kimidir.
Bəhlul əgər sənin ordundan getmişsə də, nə qorxusu var?!

[954] Paris nüsxəsində bu şəxsin adı bir yerdə Əlvənd, başqa bir yerdə Nurəddin, digər bir yerdə isə Nurəddin Əlvənd yazılmışdır. Sonuncu variant daha doğrudur *(Nəvai, şərhlər, s.517).*

[955] Səmərqəndin şimalında Əmir Teymur tərəfindən salınmış bir bağdır *(Nəvai, şərhlər, s.518).*

Az tut köhnə Bağdaddan zənbilini”[956].

Mavəraünnəhr qoşunundan əsir alınanları hazır etdilər. Hamısını inanılmış adamlarına tapşırıb onlara tam hörmət göstərdi. Xorasan qoşunu nərdivanları, ərradələri və mancanaqları tərtib etdiyi üçün gecələr şəhər camaatının son dərəcə fəğanı və ah-zarı paslı (qaranlıq) asimanın zirvəsinə çatırdı. Bir gecə şəhər camaatı güman etdi ki, sabah sultanlar savaşı (əsas döyüş) olacaqdır. O gecə heç kəs fəryaddan, şeypurdan və hay-küydən asudə olmadı. Ertəsi gün Mirzə Babur ordunu tərtib etmək və döyüşkən bahadırları həvəsləndirməklə məşğul olub şəhərin qarşısında dayandı. Bir anda darvazalardan çoxlu qoşunlar çıxdılar. Mavəraünnəhr əmirləri – Əmir Sultan Əhməd Temurtaş, Əmir Sultan, Əmir Loğman, Əmir Nursəid, Əmir Urus Ərğun, Əmir Əbdülxaliq və digər savaşçı ərlər müharibəyə gəldilər. Əmir Həsən Candarın tüməni hərçənd onlara ox yağdırsa da, səmərqəndlilərin qarşısını ala bilmədilər. Axırda onlar çadırların arasına daxil oldular, [çadırların] kəndirlərini kəsdilər, atları və kəcimləri aparmağa başladılar.

Mirzə Babur bu haldan xəbər tutduqda, öz nəfis vücudu ilə [oraya] yönəldi. Ehtiyat qoşun köməyə çatdı. Əmir Şücaəddin Hüseynəlinin[957] ətrafını yağıların bürüməsinə və sipərlərinə od vurulmasına baxmayaraq, o, önünə qalxan və çətir qoyub mətanət ayağını yerə dirədi. Onun üzünə güclü bir yara (zərbə) dəydi, lakin yerindən dəbərmədi. Bu halda qalibiyyətli məiyyət və müzəffər bayraq peyda oldu. Düşmənlər orada qalmağa macal tapmadılar. Düşmən ordusundan bir dəstə Kuhək üzərində şeypur çaldı. Həmçinin Düabə körpüsü üzərində borğu çaldılar və döyüşmək istədilər. Mirzə Babur körpü tərəfə irəlilədi, bir dəstə daş qəlblini də Kuhək[958] tərəfə göndərdi.

Xülasə, həmin gün qoşun bacardığını elədi. Belə ki, bəzi qoşunlar müqavimət göstərməyə taqət tapmadıqları üçün öz yerlərini boş qoymuşdular. Əmir Nizaməddin Əhməd və Əmir Qiyasəddin Sultan Hüseyn qarşılarına gəlmiş düşmənləri atəş saçan nizənin ucu və qraniti deşən oxun yarası ilə qırıb-tökmüşdülər. Mirzə Babur həmin gün mərdlik və mərdanəlik göstərənlərin hamısına ənam verdi, onların yolunu açdı və mənsəblərini yüksəltdi. Süstlük və qorxaqlıq edənləri isə layiqincə cəzalandırdı. Onlar lütfkarlıq gözündən uzaq düşdülər və pəhləvanlar dairəsinə qədəm qoya bilmədilər.

Xülasə, mühasirə zamanı qırx günə qədər uzandı. Heç bir tərəfə qələbə və zəfər üz vermədi. Səmərqəndlilər mühafizə şərtlərini yerinə yetirərək şəhəri əllərində saxladılar və ona yiyə durdular, xorasanlıları hasarın, bürcün və qala divarının həndəvərinə buraxmadılar. Soyuq qoşununun hücumu baş qaldırdı. Havanın soyuqluğunun şiddətindən əzaların tərpənməyə iqtidarı qalmamışdı. Hər iki qoşun mühasirənin uzanmasından təngə gəldi[959]. Ondan sonra vasitəçilər və xeyirxahlar qədəmlərini irəli qoydular və o iki böyük şanlı padşah bir-biri ilə sülh etdilər. O şərtlə ki, hər iki tərəfdən əsirlər azad edilsin və Ceyhun çayı iki məmləkət arasında sərhəd olsun.

Sonra hər iki tərəf əsirləri azad etdi. Mirzə Babur zilhiccətül-həram ayında (22.11-21.12.1454) hərəkət bayrağını Xorasana doğru qaldırdı və Kərki[960] keçidindən keçib, o yürüşdə mərdanəlik və igidlik mərasimini yerinə yetirmiş bir sıra şəxslərin qədr-qiymətinin səviyyəsini Fərqədan ulduzlarından da yüksəyə ucaltdı. Əmir Şeyx Hacını[961] Bəlxdə, Əmir Əli Farsini Sanda, Əmir Şeyx Zünnunu və qardaşı Əhməd Müştağı Əndixudda hakim və idarəçi etdi. Hökmdarın məiyyəti əziz və möhtərəm məhərrəm [ayının] 4-də (25.12.1454) darüssəltənə Herata daxil olub eyş-işrətlə məşğul olmağa başladı.

## Səncər mirzənin Pirbudaq mirzə ilə müharibə etməsi və Səncər mirzənin məğlubiyyətə uğraması haqqında söhbət

Mirzə Babur Xorasandan Şiraza gedib İraqı və Farsı ələ keçirdiyi zaman Kirman Sultan Məhəmmədin tərəfindən [oraya] vali [təyin] edilmiş Seyid Şirvaninin əlində idi. Türkmanların İraqa və Farsa hücumundan sonra səadətli xaqan Şahrux mirzə zamanından Kirman hakimliyinə miras hüquqları çatan Əmir Qa-

[956] Son misra təskinlik vermək məqsədi daşıyan və “fikir etmə, qəm yemə” mənasına gələn bir zərb-məsəldir.
[957] Paris nüsxəsi: “Əmir Simaəddin Həsənəli”.
[958] Kuhək – Səmərqəndin cənubunda yerləşir *(Nəvai, şərhlər, s.519).*
[959] Paris nüsxəsi: “Sultan Əbu-Səidin dövlət ərkanından Əmir Əli, Əbdüləli Tərxan və Əmir Əhməd Əfzəl bir dəstə digərləri ilə birlikdə xorasanlıların əlinə düşdülər”.
[960] Kərki – indiki Türkmənistanın Cərco vilayətində, Amudərya çayı kənarında rayon mərkəzidir.
[961] Paris nüsxəsi: “Əmir Şir Hacı”.

naşirinin övladları, yəni Qul Dərviş və Yar Əhmədlə onun (Seyid Şirvaninin) arasında münaqişə və düşmənçilik oldu. Bu, onunla nəticələndi ki, Kirmanın Bəm [adlı yerinə] döyüş baş verdi və Seyid Şirvani qətlə yetirildi. Sonra isə qardaşlar – Qul Dərvişlə Yar Əhməd arasında münaqişə və ziddiyyətin bünövrəsi möhkəmləndi. Yar Əhməd, Səncər mirzəni Xorasandan Kirman və Şiraz səltənətinə dəvət etdi. Səncər mirzə dörd min mükəmməl igidlə Kirmana gəldi və Kirmanı ələ keçirdi. Qul Dərviş şəhərə bitişik olan Kuh (Dağ) qalasına sığındı. Səncər mirzə təqribən on gün Kirmanda oturdu. Axırda onu ram edib qaladan endirdi və ona münasibətdə hörmət və ehtiram mərasimini yerinə yetirdi. Şeyx Cəlaləddin [ibn] Əbülxeyr Cəzərini Kirman daruğası təyin etdi, özü isə tərtib olunmuş qoşunla Qul Dərvişlə və Yar Əhmədlə ittifaq halında Şiraza getmək əzmi ilə köç etdi. Kirmandan Sərçahan[962] mövqeyinə qədər vilayət-vilayət getdi. O yerdə İsfahanın qətliam edilməsi və Pirbudaq mirzənin Şiraza hərəkəti xəbərini eşitdi. Onun qətiyyət ayağı yerindən dəbərib hərəkətə gəldi və geri çəkilmək üçün o kənddən dönüb, cilovunu boş buraxaraq qaçmağa üz qoydu. Pirbudaq mirzə yaraqlarını hazırlayıb onu təqib etdi və Heratdan, Mərvəstdən[963], Babək şəhərindən[964] və digər yerlərdən hər hansı vilayətə çatdıqda cağatay daruğalarından və düşmənlərdən hansı birini tapdısa, cəza qılıncından keçirdi.

Sircana çatdıqda kəndlərin və ətraf yerlərin qarət edilməsini əmr etdi. Qoşun çaxnaşma atəşini yandırdı. Qanaşirin oğlu Yar Əhmədin mətanət qalasının hasarına və bünövrəsinə qorxu-hürkü mancanağı zərbə vurdu. Xof oxlarının yağışı onun səbir və dözüm qalxanını para-para etdi. Acizlik və zəifliklə öz əhvalını Pirbudağa məruzə etdi, fərmana boyun əyəcəyini və tabe olacağını izhar edib itaət başını aşağı endirdi. Amma belə ərz etdi ki, Səncər mirzənin işi bitdikdən sonra təxirə salmadan kəfən və qılıncla[965] təqsirinin üzrünü istəmək üçün ən yaxşı sığınacaq yeri olan fələk misallı astanaya gələcəkdir. Mirzə Pirbudaq onun vədini və ismarışını nəvazişlə qəbul edib, oradan köç edərək Kirman ətrafında dayandı. Şəhər daruğası Şeyx Cəlaləddin də Yar Əhməd etdiyi kimi edərək şəhəri eyni şərtlə təslim edəcəyini bildirdi. Mirzə Pirbudaq bir neçə gün istirahət etmək, yorğunluğunu çıxarmaq, dəvələrin və atların rahatlanması üçün [orada] qaldı və bu səbəbdən Kirmanın ətrafında çoxlu dağıntılar törədildi. Kirman əhli Eyyub[966] kimi fitnə-fəsad qurdlarına yem və türkman dəstələrinin xofundan təpikaltı olub, arzuolunmaz bir vəziyyətə düşdü. Bu halda Səncər mirzə Lavər keçidində idi. O, özünü [orada] möhkəmlətmiş, yüklərini, mallarını və ailəsini dağda gizlətmiş, xəndək qazdırmışdı. Səncər mirzə at və silah hazırlayaraq döyüşə hazır vəziyyətə gəlmişdi. Səflərin qarşılaşması və qılıncların sıyrılması vaxtı yaxınlaşdıqda, Mirzə Pirbudaq

Nəzm

“İncəlik və bərklik vaxtında,
Gəmidən yüngül, lövbərdən ağır.
Gözü, saçı, dırnağı və başı,
Qranit, aslan, polad və mərmər kimi.
Kibrdə pələng, rəftarda şahin,
Görkəmdə hümay, gücdə aslan.
Dərin suda inci,
Alovun içində qırmızı yaqut”

kimi olan gəmi rəftarlı atına minib ordunu tərtib etməyə yönəldi. Meydanın səthi zireh geymiş süvarilər üzündən dəmir hasara bənzədi. Döyüş yerinin torpağı sıx cövşəndən və dar halqalı zirehdən polad geymiş oldu. Hər iki firqənin igidləri və hər iki dəstənin atlıları şövkətlə meydana üz qoydular və bir-birinin üstünə düşmənçilik qılıncını çəkdilər. Bir göz qıpımında toz Balıq bürcünə yüksəldi. Cahanı gəzən günəşin gözü toz-torpaqdan örtüldü.

---

[962] Sərçahan – İranın cənubunda yerləşən müasir Hörmüzgan vilayətində bir kənddir. Paris nüsxəsində Sərçahan əvəzinə Mahan yazılmışdır. Mahan isə Kirmandan cənub-şərqdədir. Lakin bu məntəqələr heç biri Kirmandan Şiraza gedən yol üzərində yerləşmədiyindən kontekstə uyğun gəlmir. Bizcə, burada Kirman – Şiraz yolu üzərində yerləşən Sircan şəhəri nəzərdə tutulmalıdır.

[963] Mərvəst və Herat – hər ikisi İranın Yəzd vilayətində yaşayış məntəqəsidirlər.

[964] Babək şəhəri (Şəhri-Babək) – İranın Kirman vilayətində şəhristan.

[965] Kəfən və qılıncla dərgaha gəlmək – təqsirin bağışlanmasını xahiş etməyin və itaət bildirməyin əlamətidir.

[966] Müxtəlif xəstəliklərə və əzablara dözən Eyyub peyğəmbər nəzərdə tutulur. Şərq ədəbiyyatında Eyyub peyğəmbərin adı səbir və dözüm timsalı olaraq istifadə edilmişdir *(Ö.F.Harman, N.Albayrak. Eyyub // TDVİA, cilt: 12, yıl: 1995, s.16-17).*

Şeir

“Savaş tozanağından günəşin gözü tozla doldu,
Kosun səs-küyündən Keyvanın başı fəğanla doldu.
At üzərindəki sərxoşun əli kimi lərzəyə gəldilər,
İş görmüş mərdlər və iş bacaran igidlər.
Parçalanmış nara döndü dikbaşların ürəyi qılıncla,
O üzdən meydanın xırda daşları nar dənələrinə döndü.
İgidlərin çöhrəsinə baxsan güman edərsən ki,
Yəməni qılınc qan tökməyə hamilədir”.

Üç dəfə cağataylar türkmanlara qələbə çaldılar. Belə ki, Mirzə Pirbudağın mətanət ayağını titrəmə tutdu. Pirqulu Kükəltaş onu fərar yönündən qətiyyət tərəfinə dəvət etdi. Çevik və cəsur cavanlardan olan Əli Həkkak İsfahani piyada dəstəsini tərtib edib hazırlayaraq cağatayların ailələrinin və yüklərinin pənah yeri olan dağın belinə üz qoydu. O, onların ailələrinin olduğu yerə gəlib, soyğun və qarət etməyə başlayaraq döyüşçülərin arasına vəlvələ və zəlzələ saldı. Hərb əhli öz ailələrinə sahib çıxmaq və mallarını qorumaq üçün yubanmadan və ləngimədən öz ailələrinin olduğu yerə qayıtdılar. Türkmanlar qələbə çalıb onları pərişan etdilər. Səncər mirzə canını xilas edib qaçdı. Qoşunun hamısı birdən dağıldı. Bir anda cağataylardan təqribən üç min nəfər, [o cümlədən] Səncər mirzənin əmirlərindən və Hüccətülislam Məhəmməd Qəzzalinin nəslindən olan Əmir Şərif, Pir Mahmud Şirazi və Qara Əhməd qətlə yetirildi. Qul Dərviş əsir tutuldu. Təqribən min nəfər öldürülmüşün başı Cahanşah padşahın ordusuna göndərildi.

Beyt

“Dəvəyə yüklü kəsilmiş qulaqlar,
Eşşəyə yüklü saman təpilmiş başlar”.

Pirbudaq mirzə Kirmanı ələ keçirməyə yönəldi. Şeyx Cəlaləddin də fərar edib Səncər mirzəyə qoşuldu. Pirbudaq mirzə Kirmanı fəth etdi və iki ay müddətində o hüdudda qaldı. Anası da Cahanşah padşahın düşərgəsindən Yəzdə gedib Pirbudaq mirzəni çağırdı. Onunla görüşdü və Allah-taalaya şükür etdi. Anasının işarəsi ilə Kirmanı qardaşı Əbu-Yusif mirzəyə tapşırdı və özü Şiraza yollandı. O, Pirqulu Kükəltaşı və Mərdinoğlunu[967] pis niyyətli adamlardan [ibarət] bir dəstə ilə Kirmana göndərdi ki, Kirmanın əsil-nəcabətlilərini, əyanlarını və böyük sənətkarlarını Şiraza köçürsün və Kirman ətdən və dəridən ayrılmış sümük kimi arınmış, yaxud aşsız kasa kimi boş qalıb səhraya dönsün. Əbu-Yusif mirzə Kirmanı bu halda gördükdə vəziyyəti ali taxtın ətəyinə ərz etdi. Cahanşah padşah o məmləkətin təmiri üçün üç yüz Təbriz tüməni və o vilayətin rəiyyətinə və əkinçilərinə yardım üçün iki yüz min batman taxıl göndərdi.

Bu halda Əlvənd bəy ibn İsgəndər mirzə ibn Qara Yusif Türkman Xorasandan hərəkət edib, Kirman ətrafına gələrək Cirüft və Rudbara[968] getdi. Yar Əhmədin tərəfindən Süleymani qalasının mühafizi olan Mahmud Farsi qalanı Əlvəndin mülazimlərinə tapşırıb özü iqta bölüyündə qaldı və Yar Əhmədi yardım və dəstək üçün çağırdı. Yar Əhməd, Pirbudaqdan qorxub çəkindiyi üçün hazırlıqlı və nizamlı bir qoşun dəstəsi ilə Əlvənd bəyin hüzuruna tələsdi və öz oğlu Qanaşirini bir dəstə etibarlı adamla qalada qoydu. Əlvəndin qüvvəti olmadığı və yanında azsaylı bir dəstənin olduğu üçün Yar Əhməd gəlişindən peşman oldu və Əlvəndi tutmağa qəsd etdi. Bu məsələ Əlvəndə aydın oldu və o da Yar Əhmədi tutmağa təşəbbüs göstərdi. Onu tərəfdarları və köməkçiləri ilə birlikdə tutub Süleymani qalasına göndərdi. Sircan[969] qalası isə Qanaşirinin ixtiyarında idi. Pirbudaq, Mirzə Məhəmməd Əlişəkəri, Dədə bəyi və Barik bəyi çoxsaylı bir dəstə ilə Sircan qalasını ələ keçirməyə göndərdi. Həmin qoşun qalanı mühasirəyə almışdı ki, Əlvənd bəy bu məsələdən xəbər tutub, sürətli yürüş edərək qəflətən onların üzərinə hücum etdi və o qoşunu tar-mar etdi. Məhəmməd Əlişəkəri, Dədə bəyi və Şeyx Məhəmməd Yasavulu əsarət kəməndinə saldı. Barik fərar edib Şiraza getdi. Məhəmməd Əlişəkəri, Dədə bəyi və bütün əsirləri Süleymani qalasına göndərdilər. Pirbudağın adamlarından təqribən yüz nəfəri qılıncdan keçirdilər. Atası dustaq edildiyi üçün Qanaşirin qalanı təslim etdi.

[967] Nüsxələrdə Din Əli, Mərdin Əli şəklində yazılmışdır.
[968] Cirüft və Rudbar (Rudbari-cənubi) – İranın Kirman vilayətinin şəhristanlarındandırlar.
[969] Sircan – Kirman vilayətində bir şəhristan.

Əlvənd Sircan qalasının daruğalığını mülazimlərindən birinə həvalə etdi. Oradan Gürgana[970] yönəldi. Ehtiyat üçün altı ay orada qalıb özünü Pirbudaq mirzənin hücumundan hifz etdi. Sonra Pirbudaq mirzə qəfil bir şimşək və şiddətli bir külək kimi sürətli yürüş edərək Şiraz tərəfdən yaxınlaşdı. Əlvənd mirzə səadətli padşahzadənin hərəkətindən agah olub Sistan tərəfə fərar etdi. Mirzə Pirbudaq Əmmar çeşməsində ona çatıb, onu bütün mülazimləri ilə birlikdə qətlə yetirdi. Oradan qayıdış zamanı Satılmış Şirəçini Sircan qalasına göndərdi. Qalanın kutvalı olan Qulu adlı şəxs qalanı təslim etdi.

Bu il əsil-nəsəbi bir neçə vasitə ilə itaəti vacib olan İmam Musa Kazıma – Allahın salamı olsun ona və nəslinə – çatan Seyid Fəllahın oğlu Seyid Məhəmməd zühur edib, Hüveyzədən, Dizfuldan və Şüştərdən ibarət bütün Xuzistanı istila etdi.

Onun özü Bağdad sakini idi və Şeyx Əhməd ibn Fəhdin tələbələrindən idi. O deyirdi ki, "mən İmam Məhəmməd Mehdinin[971] – Allahın salamı olsun ona və nəslinə - müjdəçisiyəm və imam bu yaxın günlərdə zühur edəcəkdir". O, filosofların [təliminə] və İsmailiyyə[972] məzhəbinə əməl edirdi. Sonra təqribən on min adam onun başına toplaşdı. Cəzairin[973] bir çox şeyxlərini qətlə yetirdi və qədim zamanlardan əmirlik sahibi olan Ələvilər xanədanını viran etdi. Ondan sonra hərəkət bayrağını Hüveyzəyə doğru qaldırdı. Şeyx Əbülxeyr Cəzireyi düşməni məhv edən bir qoşunla Şirazdan çıxıb onunla müharibə etdi. Məhəmməd Fəllah qalib gəldi. Şeyx Əbülxeyr Cəzireyi Şüştərə qaçdı.

O zaman Mirzə İsfahan Bağdaddan Cəzirəyə yollandı. Məhəmməd Fəllah onunla müharibə etdi. Döyüşdən və vuruşdan sonra Mirzə İsfahan qalib gəldi. Seyid Məhəmməd Fəllah Cəzirəyə yola düşdü. Mirzə İsfahan Cəzirə əhalisindən zorla çoxlu mallar alıb Bağdad tərəfə döndü. Şeyx Əhməd ibn Fəhd[974] qəribə elmlər haqqında bir kitab toplamışdı. Seyid onu ələ keçirmişdi. Buna görə də o, qəribə işlər törədə bilirdi. Məsələn, qarnına qılınc vururdu və [qılınc] əyilirdi. Bu səbəbdən ərəblərin əclafları onun müridlərinə çevrildilər. Sonra Cahanşah padşah, Əlişəkər bəyi onu dəf etməyə göndərsə də, daha sonra geri çağırıb Həsən padşahla savaşa yolladı.

### Ölümlər

Bu il tarixçilərin ən fəzilətlisi Mövlana Şərəfəddin Əli Yəzdi sükunət möhürünü dodağına qoyub, Yəzd məqbərəsində dəfn edildi. [Bunlar] onun əsərlərindəndir: "Zəfərnamə", "Künhül-murad" ("Arzu-muradın sonu"), "Hüləli-mütərriz" ("Bəzəkli paltarlar"), "Həqayiqüt-təhlil" ("Təhlil həqiqətləri"), "Şərhi-qəsideyi-bürdə" (Bürdə qəsidəsinin şərhi"). Həmçinin Hafiz şeiri üslubunda rəvan şeirlər söyləmişdir.

## 859-CU İLDƏ (22.12.1454 – 10.12.1455) BAŞ VERMİŞ HADİSƏLƏR

### Rum padşahı Sultan Məhəmmədin İnos qalasını tutması

Bu il xəbərçilər Rum padşahı Sultan Məhəmmədə ərz etdilər ki, İnos[975] hakimi həmişə yolları kəsməklə məşğuldur, İpsala[976] şəhərinin əksər qulamlarını və kənizlərini qaçırır, əgər onların sahibləri peyda olursa, muştuluq bəhanəsi ilə onun qiymətini alır, duz mədənlərində sultanın vəkilləri ilə şəriklikdən dəm vurur və sultanın vəkillərinin izni olmadan Firəng camaatına duz satır.

Ona görə də sultanın rəiyyətə qayğı və əhaliyə himayə göstərmək üçün padşahlıq şərəfi və hökmdarlıq qeyrəti ilə o diyara hərəkət etməsi və düşmənlərə layiqli cəza verməsi zəruri oldu. O, xas qulamları və yeniçəri camaatı ilə hərəkət bayrağını o diyara doğru qaldırdı. Şücaət yolunun yolçularından bəziləri Gelibolu

---

[970] Paris nüsxəsi: "Kurkan dağına"; Nuruosmaniyyə nüsxəsi: "Kurkan".
[971] Mehdi – zühuru gözlənilən qeyb olmuş gizli imam, şiələrin on ikinci imamı Məhəmməd Mehdi Sahibüzzaman.
[972] İsmailiyyə – VIII əsrdə islamın şiə cərəyanından ayrılmış təriqət. 1090-1256-cı illərdə mərkəzi Ələmut qalası olmaqla İsmaililər dövləti mövcud olmuşdur.
[973] Cəzair (Cəzirə) – Dəclə və Fərat çayları arasında vilayət.
[974] Şeyx Əbül-Abbas Cəmaləddin Əhməd ibn Məhəmməd ibn Fəhd əl-Əsədi əl-Hilli (h. 757-841 / m. 1356-1437) – Kərbəlada vəfat etmiş və orada basdırılmış şiə alimlərindəndir. Bir neçə əsərin müəllifidir. Müşəşə hərəkatının banisi Seyid Məhəmməd ibn Fəllah və Nurbəxşiyyə təriqətinin banisi Seyid Məhəmməd Nurbəxşi onun tələbələrindəndirlər *(Nəvai, şərhlər, s.525).*
[975] İnos (Enos) – Türkiyənin Ədirnə vilayətinin indiki Enez ilçəsi. Egey dənizi sahilindədir.
[976] İpsala – Ədirnə vilayətinin bir ilçəsi olub, Enezdən şimalda yerləşir.

boğazında[977] gəmilərə minib yola çıxdılar. Həmin günlərdə ildırım kimi qəfildən kafirlər qalasının ətrafını o qaniçən qoşun dağ başını bürümüş bulud kimi əhatəyə alıb tüfəng və zərbzən zərbəsi ilə qalanın bürclərini viran etdi. Sözügedən mülkün hakimi olan Təkfur[978] açıq göz və kor ürəklə özünün və tabeçilərinin həlakını müşahidə etdikdə, zərurət ucbatından qiyamçılıq və inadkarlıq qalasından, kafirlik və mürtədlik hasarından aşağı enib İnos və Tasos[979] qalalarının açarlarını sultanın vəkillərinə təslim etdi. Sultan o şəhərlərin fəthindən sonra öz diyarına tərəf geri qayıtdı.

O əsnada xəbər çatdı ki, Despot hakimi, mat-məəttəl qalmış o köhnə gavur cəhənnəmə vasil olmuşdur[980]. İndi Las məmləkətinin gəlini nazlı gözəllər və aşiqlərə nəvaziş göstərən məşuqlar kimi sultanın xütbəsi üçün cilvə etməkdə, qazi padşahın izdivacının intizarını çəkməkdə və könlünü almaqdadır. Ona görə də sultan rəvan qumdan artıq [sayda] bir ordu ilə o diyara yönəldi və Novaberi (Novoberda) qalasını əhatəyə aldı. O qala möhkəmlikdə Misir ölkəsinin ehramları kimi, mətanətdə İsgəndər səddi və Xeybər qalası kimi məşhurlaşmışdı. Orada oturanların əli fələyin Qız bürcünə çatırdı və sakinlərinin qulağı mələyin zümzüməsini eşidirdi.

Beyt

“Bisütunun[981] təməli ilə möhkəmlikdə tən gəlirdi,
Asimanın yüyəni ilə hündürlükdə yarışırdı”.

Oranı almaq sevdası keçmiş hökmdarların ağlından belə keçməmişdi. Rumilər top zərbəsi ilə o daş qalanın mətin bünövrəsini kafirlərin dövləti kimi dağıtdılar. Kafirlər izdihamlı qoşunların qorxusundan qalanı təslim etdilər[982]. Sultan oradakı gümüş mədənlərinə inanılmış məmurlar və zabitlər təyin etdi. Sərihə qalasının fəthindən sonra Qaraca bəyi Rumeli axınçıları ilə Sihivri qalası tərəfə göndərdi[983]. Qalibiyyətli qoşun sözügedən qalanın fəthindən sonra Kosova səhrasında sultanın ordusuna qoşuldu.

O diyarın fəthindən sonra şəfqət şüarlı padşah izdihamlı ordunun tamamına öz məskənlərinə qayıtmaq icazəsi verdi və məhdud bir dəstəni öz yanında saxladı. O, öz xas müsahibləri və səmimi nədimləri ilə Selanik şəhərinə yola düşdü. O diyara tamaşa etdikdən sonra Ədirnə tərəfə qayıtdı. Ondan sonra İstanbula yollandı. O zaman Vilkoğlunun elçiləri bol peşkəşlə sultanın dərgahına gəlib, xidmətkarlıq və itaətkarlıq üzündən hər il qırmızı qızılla otuz min dinar flori bac verməyi qəbul etdilər.

**Xorasanda baş vermiş hadisələr haqqında söhbət**

Bu il Mirzə Babur, Əmir Xəlil [ibn] Hindukəni Üveys Tərxan və digər bahadırlardan [ibarət] bir dəstə ilə birlikdə Sistanı ələ keçirməyə göndərdi. Çünki oranın valisi Şah Hüseyn ali məqamlı şahın xadimlərinə təzim və ehtiram göstərmirdi. Zəfər şüarlı ordu Tanrının köməyi ilə o diyara çatdıqda, Şah Hüseyn düşmənçiliyi və münaqişəni tərk edib fərar yolunu tutdu. Tamam Nimruz[984] məmləkəti Əmir Xəlilin iqtidar əlinə keçdi. O əsnada Şah Hüseyn bir dəstə igidlə Sistana yollandı. Çoxlu savaşdan sonra o yaramaz idbar məğlub olub, etimadlı adamlarından üç-dörd nəfərlə Kic və Məkran tərəfə yollandı. Yol əsnasında öz mülazimlərindən birini atdan endirib onun atını rəğbət bəslədiyi bir oğlana verdi. Həmin mülazim onun kinini ürəyində saxlayıb onun ardınca getdi. Gecə yarısı onlara çatıb onları yatmış gördü. Şah Hüseynin və Şah Qivaməddinin başını bədənindən ayırıb geri döndü və onların başlarını Əmir Xəlilin hüzuruna gətirdi.

---

[977] Gelibolu boğazı – Dardanel (Çanakkale) boğazı nəzərdə tutulur.

[978] Həmin zaman İnos (Enez) hakimi Qattilusi sülaləsindən olan II Dorino idi. II Məhəmməd Fatehin bu yürüşü 1456-cı ilin yanvarında baş vermişdi *(Nəvai, şərhlər, s.528).*

[979] Tasos – Egey dənizinin şimalında yerləşən, Osmanlıların Taşoz dedikləri adadır. Hazırda Yunanıstana tabedir.

[980] Serbiya hökmdarlarının titulu “despot” olduğu üçün burada Serbya nəzərdə tutulmuşdur. Lakin Serbiya hökmdarı Georgi Branković 24 dekabr 1456-cı ildə ölmüşdür *(Nəvai, şərhlər, s.529).*

[981] Bisütun dağı – Həmədan şəhərindən təqr. 100 km qərbdə yerləşir.

[982] Novoberda qalası 1 iyun 1455-ci ildə fəth edilmişdir *(Nəvai, şərhlər, s.530).*

[983] Novoberda 1455-ci ilin iyun ayında fəth edildikdən sonra Tirbiçe (Baniçe) şəhəri də Osmanlıların əlinə keçmişdi *(İ.H.Uzunçarşılı. Osmanlı tarihi. II c., s.37).*

[984] Nimruz – tarixi Sistan vilayətinin bir hissəsini təşkil edir. Hal-hazırda Nimruz Əfqanıstanın cənub-qərbində yerləşən bir vilayətdir və inzibati mərkəzi Zərənc şəhəridir.

Həmçinin bu il Mirzə Babur yenidən Mirzə Səncərə iltifat nəzəri ilə baxdı və onu Mərv və Maxan[985] tərəfdə hakim və idarəçi [təyin] etdi.

Həmçinin bu il İmad qalasında məhbus olan cəmi mazandaranlılar qiyam qaldırıb qala kutvalını qətlə yetirdilər. Məşhəd şəhərinin daruğası Cəlaləddin Mahmud qalanı ələ keçirib mazandaranlıları qətlə yetirdi.

Həmçinin bu il Sultan Əbu-Səid, Mirzə Babura Səmərqənddən bir neçə şahin göndərib Xoca Mövlananı[986] istədi. Mirzə Babur, Mövlanaya hörmət göstərdikdən sonra onu elçilərlə birlikdə göndərdi.

Həmçinin bu il Rum padşahı Sultan Məhəmmədin elçiləri Herata gəldilər. Mirzə Babur onlara hörmət göstərib Rum diyarına yola saldı.

Həmçinin bu zaman Əmir Təhərtən övladlarının qasidləri Ərzincandan asiman nişanlı dərgaha gəldilər.

Əmirzadə Əlvənd ibn İsgəndər ibn Qara Yusif Türkmanın mülazimləri də gəlib onun düşmənlərlə olan əhvalatını məruzə etdilər.

## 860-CI İLDƏ (11.12.1455 – 28.11.1456) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Rum padşahının Belqrad qalasını mühasirə etməsi

Bu il Rum padşahı Sultan Məhəmməd əndazəsiz və saysız-hesabsız bir ordu ilə əzəmət və iqtidar üzündən Belqrad tərəfə hərəkət etdi. Üsküp şəhərində[987] qazğan və top tərtib etdi. Saysız-hesabsız kiçik və böyük gəmiləri qalanın giriş-çıxışını tutmaq üçün hər iki çaya[988] yolladı. Semendire keçidindən gəmiləri Tuna çayına salıb Belqrad qalası önünə gətirdi. Engirüs kafirlərinin gəliş-gediş yolunu kəsdilər. Sultan da Xasbək[989] dərbəndindən (keçidindən) keçib qala ətrafında dayandı. O, böyük bir qaladır. Onu Tuna (Dunay) və Sav (Sava) çaylarının qovuşduğu yerdə tikmişlər, binasının sütunlarını yerdəki qayalıqdan səmanın zirvəsinə qədər ucaltmışlar.

Şeir

“Elə bir qala ki, cahanın gözü qarşısında,
Yeddinci asimandan daha ucadır.
Fələk bürcləri onun bürclərinin kölgəsində qalmışdır,
Çevrəsi yer üzü kimi genişdir.
Aşağıdan o bürclərə baxanda,
Səma gəlir nəzərə Süha kimi.
Yuxarıdan baxdıqda, sanki quyu dibində
Fələk çeşmədir və ay balığın gözüdür”.

Rum qoşunu (çərik) yerin mərkəzini əhatəyə alan səma kimi qalanın ətrafını mühasirəyə aldı. Yan-yörədən və ətrafdan sərsər küləyi kimi sərt həmlələr etdilər. Qılıncın parıltısından və xəncərin işartısından bədbəxt kafirlərin ödü qan oldu və bayraqları başı aşağı döndü. Top mərmilərinin zərbəsi ilə qala divarını kiçik zərrələr (tozlar) kimi yolun torpağına tökdülər.

O əsnada kafirlik və zəlalət əhlinin dəstəbaşısı Kral Yanko cəsur adamlardan [ibarət] bir qoşunla döyüş və savaşdan ötrü Engirüs əmirləri ilə birlikdə təbil və kosla gəmiyə minib mümkün olduğu qədər təcili surətdə adlı-sanlı sultanın üzərinə getdi və çoxsaylı bir ordu ilə Tuna çayı kənarında, Rum qoşunlarının qarşısında lövbər saldı. Bu halda gəmilərin sərdarı olan Rumeli bəylərbəyisi Qaraca paşa dedi ki, “gəmiləri qalanın qarşısındakı adada, Belqradla Engirüs arasında saxlayaq və o adadan top zərbəsi ilə kafirlərin gəmilərini pərən-pərən salaq”. Sultanın əmirləri qəbul etmədilər. Təsadüfən, kafirlərin gəmirləri o adanın yanına çatdılar. Kral Yanko, Qaraca paşanın təklif etdiyi üsulla öz gəmilərini o adada topladı. Rumilər səhlənkarlıq

[985] Maxan – Mərv yaxınlığında tarixi şəhər *(Извлечения из географического сочинения Хафиз-и Абру, пер. С.Л.Волина // Материалы по истории туркмен и Туркмении. Том I. VII-XV вв. Арабские и персидские источники. Москва-Ленинград, 1939, с.527).*
[986] Xoca Bürhanəddin Mövlana Səmərqəndi *(Öztürk, şərhlər, s.339).*
[987] İndiki Makedoniyanın paytaxtı olan Skopye şəhəri.
[988] Belqradı əhatə edən Dunay və Sava çayları nəzərdə tutulur *(Nəvai, şərhlər, s.533).*
[989] Xasbək – Kosovadan Belqrada gedən yol üzərində yerləşən Jasterbak dağındakı aşırım nəzərdə tutulur.

etdikləri üçün peşman oldular. Düşmənlər top zərbəsi ilə Rum gəmilərini qarşılarından uzaqlaşdırdılar. Kral Yanko sudan keçib, qalanın içinə daxil olaraq çoxsaylı qoşunla sultanın önündəki dağ kimi bir bürcdə qərar tutdu. Rum qoşunları top zərbəsi ilə bürclərdə və hasarda çoxlu dəliklər açdıqları və o qalanı zəbun etdikləri üçün hücuma keçdilər. Taxta və dəmir qalxanlar, mətin nərdivanlar və kəndirlər götürüb qalaya doğru qaçdılar. Hər tərəfdən top-tüfəng sədasını göy üzünə çatdırdılar.

Şeir

“Tüfəng tüstüsündən kin buludu qətrə yağdırdı,
Atəşlə dolu manqala döndü qalanın içi.
Mavi səmaya o qədər ox atıldı ki,
Günəş pəri kimi qanad açdı.
Döyüş meydanına düşən daşlardan,
Yerdə Qaf dağı peyda oldu”.

Bu yöndə fövqəladə şücaət göstərildi. Yüksək təməlli bir qalada mövqe tutmuş belə bir qüvvətli və bacarıqlı qoşuna qarşı döyüşüb vuruşaraq təxminən beş yüz yeniçəri özünü qalanın içinə saldı. Kral Yanko yeniçərilərin daxil olması ucbatından qala içində iztiraba və çətinliyə düşdü. O, hiddət və qəzəblə zəmanə igidlərinin bir dəstəsini yanına alıb o dəliyin olduğu yerə yönəldi və Rum ordusunun giriş yolunu bağlayıb əksər yeniçəriləri qətlə yetirdi. Sultan Məhəmməd yeniçərilərin qətlindən və dilavərlərin məğlubiyyətindən sonra öz nəfis vücudu ilə qaniçən qılıncını intiqam qınından sıyırıb düşmənlərə həmlə etdi.

Beyt

“Açdı sitəm qılıncı ilə dəmbədəm,
Vücud səthində yoxluqdan bir qapı”.

Qaladan bayıra çıxanları qalanın qapısına kimi qovdu. Amma kafirlərdən və müsəlmanlardan bir neçə min nəfərin başı yol torpağı ilə yeksan oldu.

Beyt

“Təkəbbürdən ərşə çıxmış baş,
Ayaqlar altında daş döşəmə oldu”.

Qaraca paşa bir dəstə süvari ilə qətlə yetirildi. Ürək deşən oxların və ildırım kimi çaxan tüfənglərin [güllələrinin] gəliş-gedişi əsnasında qaragün kralın gözünə bir ox dəydi. O, yüz möhnətlə qəm və kədərə yoldaş olub cəhənnəmə yollandı[990]. Amma rumilər xəbərdar olmadılar. Rum və Firəng orduları qırğın atəşini alovlandırmağa davam etdilər. Axırda şəfəq öldürülmüşlərin qanından aşiqlərin göz yaşlarını kirpiklərinin altına çəkdikləri kimi ətəyini bir tərəfə çəkdi və günəş o savaşın qorxusundan təlaşa qapılıb məğribin niqabı içində gizləndi. Sultan o qalanın ətrafından köç edib öz diyarına yollandı. Üç gün sonra kralın göz yarasını və o pis əməlli kafirin [o biri dünyaya] köçməsini eşitdi. Lakin fürsət əldən verildiyi üçün geri qayıtmaqdan vaz keçdi. Sonra Ədirnəyə yollandı.

### Xorasan diyarında baş vermiş hadisələr haqqında söhbət

Bu ilin əvvəllərində Babur mirzənin səhhəti pozuldu. Günbəgün onun xəstəliyinin şiddəti artdı. Məsih nəfəsli[991] təbiblər müalicə işində çoxlu səy göstərdilər. Axırda tamamilə sağaldı. Sonra şəhərlərin və bəndələrin hökmdarı naxoşluq günlərində kəcavəyə oturub seyrə çıxdı. Bu əhvalat baş verən zaman böyük bir quyruqlu ulduz (kometa) peyda oldu. O, Heratın taleyi olan Buğa bürcündə və Mirzə Baburun taleyi olan səkkizinci xanədə özünü göstərdi. Şərq tərəfdən dan yerinin söküldüyü vaxtdan günəşin doğuşuna az zaman qalana qədər son dərəcə geniş, uzun və qorxunc halda nəzərə çarpdı. Bir neçə gün də qərb tərəfdə açıq-aydın göründü. Sonra camaat arasında çoxlu şayiələr yayıldı. Mirzə Babur buyurdu ki, Seyid Rüknəddin Amoli və Mövlana Həsən Bərzgər bundan hökm çıxarıb məruzə etsinlər. Onlar [hökmdarın] ali könlünü rahatlatmaq üçün ərz etdilər ki, “bunun əlaməti savaş, qan tökmək, sultanların kədərə batması, möhnətin və cürbəcür bə-

[990] Yanoş Hunyadi bu hadisədən 20 gün sonra, 11 avqust 1456-cı ildə vəfat etdi *(Nəvai, şərhlər, s.535).*

[991] Məsih – İsa peyğəmbərin ləqəblərindəndir biridir. Dini rəvayətlərə görə, İsa peyğəmbər nəfəsi ilə ölüləri dirildərmiş. Burada Həsən bəy Rumlu həkimlərin istedadını göstərmək üçün “Məsih nəfəsli” ifadəsindən istifadə etmişdir.

laların baş qaldırması və taun əzabıdır; lakin bunlar bizim diyarda baş verməyəcəkdir”. Axırda isə bu bəlaların hamısı Xorasan diyarında baş verdi.

Həmçinin bu zaman Rumdan Sultan Məhəmmədin elçiləri və Ərzincandan Əmir Təhərtən övladlarının elçiləri Herata, Mirzə Baburun hüzuruna gəldilər və hörmətlə qəbul edilib öz diyarlarına geri döndülər[992]. O əsnada Sultan Əbu-Səidin elçisi gəlib Mirzə Uluğ bəyin yeni “Zic”ini gətirdi.

Şaban [ayının] 26-da (30.07.1456) cahan hökmdarı müqəddəs Məşhədə hərəkət etdi. Sefid bağından Muxtar bağına köçdü. Bütün ramazan (avqust, 1456) və şəvval (sentyabr, 1456) ayını səadət və uğurla o məkanda keçirib zilqədənin (oktyabr, 1456) əvvəllərində dünyanı gəzən atının yüyənini məqsədə doğru çevirdi. Sözügedən ayın 14-də (14.10.1456) Məşhədin Çaharbağı qalib hökmdarın qədəmlərinin uğuru sayəsində cənnət bağına qısqanclıq bəxş etdi. Ertəsi gün bəşəriyyətin və könül mülkünün sultanı olan, “bədənimdən bir parça Xorasan torpağında dəfn ediləcək”[993] [hədisinin] taxtında oturan, səkkizinci imam Əli ibn Musa Rzanın – ona salam olsun – ziyarətinə getdi.

Nəzm

“Üfüqlərin şahı, Xorasanın sultanı,
Misir mülkünün və can aləminin əzizi.
Kəlamı əhsən və ehsan mənbəyi,
Məqamı islam və iman Kəbəsi.
Rəvan olub yüz can ətrafında təvafa,
Onu bir dəfə təvaf etmək yeddi Həccin savabıdır”,

Mələklərin yuvası olan o astananın mücavirlərinə hədiyyələr və nəzirlərlə nəvaziş göstərdi. Bu əsnada əmirlər və dövlər ərkanı arasında bir neçə dəfə münaqişə və ziddiyyət baş verdi. Axırda bir-biriləri ilə sülh etdilər. Dostluq və anlaşma meydana gəldi. Qərar verdilər ki, zamanın imamının[994] – ona salam olsun – astanasına gedib əhd-peyman bağlasınlar ki, bir daha bir-biriləri ilə münaqişə etməyəcəklər. Bir tərəfdən Əmir Məhəmməd Xudadad, Əmir Şir Hacı və Pəhləvan Hüseyn Divanə, digər tərəfdən isə Şeyx Əbu-Səid, qardaşı Əmir Hüseynəli və Xoca Vəcihəddin Simnani ziya bəxş edən məqbərəyə daxil olub, qeyd edildiyi kimi əhd bağladılar və ağır andlarla peymanı möhkəmlətdilər. Adlı-sanlı əmirlər ali məclis qurub xahiş etdilər ki, padşah da oraya buyursun. Gözəl əxlaqlı hökmdar onların otağını öz hüzurunun nuru ilə işıqlandırdı. Həmin günlərdə soyurğalları bir-birinə bitişik olan Əmir Məhəmməd Xudadadla Əmir Həsən Şeyx Teymur arasında bir tarla üstündə dava çıxdı. Əmir Məhəmməd, Əmir Həsənin başına bir çomaq vurdu. O, padşahın qarşısında diz çöküb əhvalatı ərz etdi. Mirzə Babur qəzəblənib Əmir Məhəmmədin başına bir neçə çomaq [zərbəsi] vurdu. Əmir Şir Hacı və Əmir Şeyx Əbu-Səid xahiş üçün irəli gəlsələr də, onlar da zərbəyə məruz qaldılar. Dindar padşah o vaxtlarda şərab içməkdən tövbə etmişdi və əksər günlərdə saz əhli və xoş avazlı xanəndələrlə müqəddəs Məşhədin mənzillərində vaxt keçirirdi.

Bir gün ürək açan bir yerdə və ruh yüksəltən bir mövqedə oturmuşdu ki, gözlənilmədən padşahın və əmirlərin yaxınlığındakı bir daşın üzərində dağınıq saçlı və gözəl üzlü bir dərviş peyda olub dünyanın vəfasızlığı barədə qəribə bir tərcibənd oxumağa başladı. Belə ki, sayı təxminən əlliyə çatan o beytləri eşitdikdə böyüklərin və kiçiklərin könlü hüznləndi. O tərcibəndin bir bəndi belədir:

Beyt

“Bu varlıq aləminin bütün təmtərağı,
Cünun əhlinin gözündə heç nədir”[995].

Dərviş bu tərcibəndi bitirdikdən sonra yoxa çıxdı. Belə ki, səltənətin məskəni olan astananın mülazimləri onu nə qədər axtarsalar da, tapa bilmədilər. Mirzə Babur o qışı müqəddəs Məşhəddə keçirdi.

---

992 Bu hadisələr az öncə h. 859-cu ilin hadisələri sırasında qeyd edilsələr də, əslində, burada yazıldığı kimi, h. 860-cı ilə aiddirlər *(Nəvai, şərhlər, s.537)*.

993 Peyğəmbər hədisidir.

994 Nuruosmaniyyə nüsxəsində sadəcə “imamın günbəzinə” yazılmışdır ki, biz bu variantı daha məqbul hesab edirik. Çünki burada İmam Rzanın Məşhəddəki məqbərəsinin ziyarəti nəzərdə tutulmuşdur.

995 Bu beyt Qasım Ənvardandır *(Nəvai, şərhlər, s.538)*.

**Diyarbəkrdə baş verən hadisələr, Həsən padşahın Amidi tutması, o sərvərin Cahangir mirzə ilə və alinəsəb padşahla, yəni yüksək şanlı padşah Cahanşah padşah Türkmanla[996] müharibə etməsi haqqında söhbət**

Bu il Həsən padşah mülazimlərindən qırx nəfərlə birlikdə qardaşı Mirzə Cahangirin qorxusundan Diyarbəkr ətrafında heyran və sərgərdan halda gəzirdi. O zaman xəbər gəldi ki, Mirzə Cahangir çoxlu qoşunlarla kürdləri qarət etmək üçün Amiddən çıxmışdır. Ona görə də zəmanə hökmdarı yaxşı silahlanmış bahadırlardan [ibarət] bir dəstə ilə sürətli yürüş etdi. O, Bəhram kimi qəhredici qoşununu şəhərin bir fərsəxliyində qoyub, öz nəfis vücudu ilə əyninə köhnə bir xırqə geyib, altından qılınc bağlayıb, Əmir Ömər Xudadadın qardaşı Pir Ömər və b. kimi dörd mülazimlə Amid darvazasına çatdı. Gözətçilər istədilər ki, darvazanı bağlasınlar. Həsən padşah son dərəcə cəsarət və şücaətlə belindən qılıncını çəkib özünü içəriyə atdı. Onun yanındakı nəfirçi (şeypurçu) şeypur çaldı. Şeypurun səsini eşidən digər əsgərlər atlarını çapıb özlərini şəhərə saldılar. Şəhərdə Cahangir mirzənin mülazimlərindən heç kim olmadığı üçün rəiyyət tabe oldu.

Həmin zaman Mirzə Cahangir Qaracadağda idi. Şeyx Həsən bəy Kürd o nadan cahilin yanına yaxşı nitq qabiliyyətinə malik adamlar göndərib ərz etdi ki, “Həsən padşah döyüşkən bahadırlardan [ibarət] bir dəstə ilə elini və məiyyətini tərk edib və haraya getdiyi məlum deyildir”. Cahangir mirzəni tamamilə əlacsızlıq bürüdü. O, Amid tərəfə tələsdi. Bürcün kənarına çatıb vəziyyəti öyrəndi və tam səylə Mardinə yollandı.

Həsən padşah öz məiyyəti və ordusu ilə Amiddə yerləşdikdən sonra bütün Ağqoyunlu tayfaları ona alqış dedilər, töhfələr verdilər və onun səltənətini qəbul etdilər. Mirzə Cahangir aləmi tutan padşahın xofundan Azərbaycana və İraqa yola düşdü və Dərgəzin qəsəbəsində müzəffər padşahın (Cahanşahın) ordusuna gəldi.

Cahanşah padşah, Rüstəm [ibn] Tərxanı, Həmədan hakimi Əlişəkər bəyi və Savalan bəyi iyirmi min süvari ilə alinəsəb şahzadəyə qoşub Diyarbəkrə göndərdi. O böyük ordu Mardin ətrafında Həsən padşahın qarşısında səf çəkdi. İlk öncə Cahangir mirzə və Rüstəm Tərxan bahadırlar dəstəsi ilə qılınc sıyırıb, Həsən padşahın [qoşununun] mərkəzinə həmlə edərək iti qılınc və atəş saçan nizə zərbəsi ilə onları məğlub etdilər. Əlişəkər bəy, Həsən padşahın sağ cinahını qarşısından uzaqlaşdırıb onları təpənin o biri tərəfinə qovdu və geri qayıdan əsnada Həsən padşahla rastlaşdı. O həzrət on nəfərlə dayanmışdı və döyüşə baxırdı. O həzrət ordunu təhrik və təşviq etmək üçün qışqırıb deyirdi ki, “düşmən məğlub olmuşdur, narahat olmayın, bu camaatın çarəsiz çırpıntılarından qorxmayın, özünüzü igidlik və mərdlikdən kənar tutmayın!”. Lakin onun adamları son dərəcə çaşqınlıqlarından, xoflarından və dəhşətlərindən öz yerlərində duruxub qalmışdılar. Elə bil ki, onların ayaqları çadır çubuğu kimi torpağın içinə batmışdı və onların boyunları sanki kəndirlə bağlanmış, iztirab və əlacsızlıq divarının arxasında qalmışdılar.

Həsən padşah onların köməyindən ümidini üzüb həmin azsaylı dəstə ilə döyüşə atıldı və düşməni yerindən dəbərdib pərakəndə etdi. Bir say-seçmə adam arxada qalmışdı. Sultan Əhməd, Şeyx Həsən və Tuman Basan ona nizə vurdular. Sahibqiran da onu nizə ilə vurdu və onu atdan saldılar. Ehtiyat etdilər ki, bəlkə də, bu, Əlişəkərdir. Onun əsgərləri o həzrətin qoşununun azlığını müşahidə etdikdə geri döndülər və həmlə etdilər. Qələbəlikləri, üstünlükləri, qüvvətləri və mübarizələri ilə Əlişəkəri onların əlindən aldılar və Həsən padşahın qoşununa hücum çəkdilər. Sərxoşlar məclisi kimi bir vuruşma baş verdi. Ağır gürz dikbaşların boynunu qırırdı. Ölüm ahəngli ox atla süvarini bir-birinə tikirdi.

Nəzm

“Qılınc ağıl kimi kişilərin başında qərar tutmuş,
Gürz xəyal kimi igidlərin ürəyində yer etmiş.
Mizraq belə bağlanmış, ox isə ağız açmış,
Mübarizlərin canına qəsd etmək və öldürülənlərin qanını almaq üçün.
Bulud kimi tozanaq və sel kimi qorxunc süvari,
Şimşək kimi parlaq qılınc və göy gurultusu kimi at kişnəməsi”.

Rüstəmin adamları tam məğlubiyyətə uğradı. O həzrətin bahadırlarından heç kim qalmadı ki, birini, ikisini və ya daha çoxunu əsir etməmiş olsun. Təkcə Qasım Əmiraxur cəbbə geymiş dörd nəfəri tutub gətirdi.

---

[996] Nuruosmaniyyə nüsxəsi: “Cahanşah padşahın əmirləri ilə”.

İshaq ağa üç nəfər gətirdi. Rüstəm bəyi Cahanşah bəyin[997] nökəri Kürd Ramazan, Əlişəkər bəyi Osman Mehmandar, Pirəlini Xəliloğlu, Güşayişi Məhmad bəyin nökəri, Savalanı isə Şahəli bəyin Əlif adlı nökəri tutub o həzrətə təqdim etdilər. Böyük əmirlərdən, nökərlərdən, adlı-sanlı kişilərdən, nadir süvarilər olan cavanmərdlərdən min yeddi yüz nəfər cəbbə geymiş adam əsir alındı. Çox sayda cövşənsiz və cəbbəsiz adam da tutulmuşdu. Şahəli bəyin və Şahsüvar bəyin əsgərləri qaçıb gəmiyə mindilər. Sonra onlara xəbər çatdı ki, Həsən padşah oraya gəlməkdədir və yaxınlaşmışdır. Onlar son dərəcə qorxu-hürküyə, çaşqınlığa və tələşa qapılıb, özlərini gəmi ilə qərq edərək həlak oldular. O həzrət düşmənlər üzərində zəfər qazandıqdan sonra geri qayıdıb məşəl altında beş yüz nəfərin boynunun vurulmasını əmr etdi. Buyurdu ki, düşmənlərin mallarını və ərzaqlarını zəbt etsinlər və ələ keçirsinlər. Bunlardan xatircəm olduqdan sonra özünün qələbə və düşmənin məğlubiyyət xəbərini evinə göndərdi və o yurddan köç edib Telli-Hüseyndə dayandı. Buyurdu ki, Rüstəm Tərxanı onun qanlısına təslim etsinlər. Böyük bir izdiham toplandı. Cəllad onun qanını tökmək üçün hazır oldu. Rüstəm qılıncın iti olub-olmadığını soruşdu ki, çox əzab çəkməsin. Qılıncı ona göstərdikdə o, bunu bəyənmədi və Uruq Məhəmməd Tuşmalın qılıncını istəyib dedi ki, “məni bu qılıncla öldürün!”. O, elə bir qılınc idi ki, Baba Əbdürrəhman Ağziyarət[998] mövqeyində onu Həsən padşahın belinə təkbəndlə[999] bağlamış, onu bir tasa vurub demişdi ki, “bu, Tərxanoğlunun başıdır”. Bu, o həzrətin zahiri qəribəliklərindən və kəramətlərindən idi və bir dəstə Ağqoyunlu bu kəramətdən xəbərdar və şahid olmuşdular.

Onun qətlindən sonra Əlişəkəri Cermük qalasına, oğlu Pirəlini Ərqənin qalasına, Savalan bəyi isə Çüngüşə[1000] göndərdi. O yurdda beşdə bir (xüms) tutdular və Əbar (Anbar) çayının Dəcləyə töküldüyü yerə gəldilər. Cahangir mirzədən üz döndərib arvad-uşaqlarını və yaxınlarını Mardindən çıxarmış əksər Ağqoyunlu camaatı gündən günə böyüyən dövlətə sığındı. Həsən padşahın qardaşı Üveys bəy də himayə kölgəsi altında yer aldı. O həzrət Mardini mühasirə etməyə getdi. Mardində azuqə qalmamışdı. Həsən padşahın anası xahiş üçün gəldi ki, “axı Cahangir mirzə və onun arvad-uşağı haraya getsin?”. O həzrətə abır-həya mane oldu və bu hərəkətdən vaz keçdi. Amma anasından xahiş etdi ki, “qardaşım Cahangir mirzə gərək özünün bir oğlunu mənim xidmətimə göndərsin”. Xahişi qəbul olundu. Əlixan mirzəni ali taxtın ətəyinə göndərdilər. Savur qalasının hakimi Məhəmməd bəy əsir tutulduğu üçün Savur qalası da ələ keçirildi. [Həsən padşah] o qalanı Xəlil Təvaçıya bağışladı və oradan yaylağa yola düşdü. Rüstəm Muradı isə İsa bəyi mühasirə etməyə təyin etdi. Rüstəm Murad mühasirə bəhanəsi ilə ordudan ayrıldı və Rüstəm Tərxanın cavahiratını və xəzinəsini ələ keçirdiyi üçün Ruma qaçdı.

Həsən padşah Ərzincana çatdıqda o şəhərin viran və sakinlərinin pərişan olduğunu gördü. O, rəiyyətin könlünü alıb onları öz vətənlərinə və məskənlərinə geri dönməyə dəvət etdi. Şəhərin hakimliyini Xurşid bəyə tapşırdı. O həzrət İspir qalası hakimi Bayəzid bəy Pornaka yardım göstərmiş, onu Əmir Ərəbşah Kürdün əlindən xilas etmişdi. Lakin o, vilayətdə baş qaldıran taun ucbatından [Həsən padşahın] köməyinə gəlməmişdi. İndi isə o, xəzinədə yığılıb qalmış böyük miqdarda malları götürərək büsatı öpmək üçün özünü dərgaha çatdırdı. Rum və Şam hüdudlarının əmirləri üzrxahlıq edərək hüzura peşkəş gətirdilər və feyz mənbəyi olan həzrətin iltifatının zövqünü dadaraq öz vilayətlərinə qayıtdılar.

Həsən padşah da Diyarbəkr qışlağına hərəkət edib Amidə getdi. Rəqqə[1001] ətrafındakı Kəbeyn, Üneyn və Bəni-Rəbiə[1002] kimi ərəb qəbilələri Şam, Rum və Diyarbəkr arasında yolları kəsdikləri və müsəlmanlara hücum edib zərər vurduqları üçün o həzrət o hüdüdun mühafizəsi üçün qoşun çəkib həmin ərəbləri qarət etdi. Qələbə şüarlı əsgərlərin əlinə çoxlu mal və ərzaq, atdan və dəvədən [ibarət] saysız heyvan və qənimət keçdi. [Həsən padşah] layiqli bəxşişlər etdi və adlı-sanlı, bahalı atları hər kəsə bağışladı. Oradan da yaylağa döndü və qəzavat[1003] məqsədi ilə Gürcüstana hərəkət etdi. Bunun şərhi daha sonra qeyd ediləcəkdir, inşallah.

[997] Cahanşah bəy – Uzun Həsənin qardaşıdır *(Nəvai, şərhlər, s.541).*
[998] Ağziyarət – Türkiyənin Mardin vilayətində, Qızıltəpənin qərbində yerləşir *(Öztürk, şərhlər, s.346).*
[999] Təkbənd – ipəkdən, dəvə yunundan və s. bu kimi materiallardan hazırlanan kəmər növüdür *(Nəvai, şərhlər, s.542).*
[1000] Cüngüş – Türkiyənin Diyarbəkr vilayətində, Çermik ilçəsindən şimal-qərbdə yerləşən bir ilçədir.
[1001] Rəqqə - Suriyanın şimalında, Fərat çayının şimal sahilində, Hələbdən 160 km. şərqdə yerləşən şəhər.
[1002] Nüsxələrdə: Bəni-Səbəə.
[1003] Qəzavat və cihad – din yolunda aparılan müqəddəs müharibələr.

**Cahanşah padşahın Damğana qoşun göndərməsi və o diyarın hakiminin fərar etməsi haqqında söhbət**

Baharın əvvəllərində Məhəmmədi mirzə və Əmir Bistam, Bəhram kimi intiqamçı əsgərlərlə hərəkət bayrağını Damğan tərəfə qaldırdılar. Mazandaran hakimləri ilə Rüstəmdar və Həzarcərib[1004] məlikləri onların ordusuna qoşuldular. Damğanın ətrafı zəfər nişanlı əsgərlərin dayanacaq yeri olduqda, Mirzə Baburun tərəfindən o diyarın valisi olan Əmir Nasirəddin Simnani qalanı möhkəmləndirib ox və daş[1005] atmağa başladı. Türkman əsgərləri xəndəyi çör-çöplə doldurdular. O əsnada Qazı Əbu-Bəkr Tehrani, Əmir Nasirəddin Simnaninin yanına gedib, dostcasına nəsihət verərək onu sülhə dəvət etdi. Əmir Nasirəddin cavab verdi ki, "əgər şahzadə şəhərin üç fərsəxliyindəki Astanaya gedərsə, mən arvadımı və adamlarımı götürüb fərar edərək bir guşəyə çəkilərəm və şəhəri təslim edərəm". Əhd-peyman bağlandıqdan sonra Məhəmmədi mirzənin doğru düşüncəsi belə qərara gəldi ki, onların xahişini qəbul etsin. Ona görə də köçmək əmri verdi. Əsgərlər qalanın ətrafından qalxdılar və Astanaya yollandılar. Əmir Nasirəddin yaxınları və malları ilə Herata yola düşdü. Türkman qoşunu o diyarı ələ keçirdi.

**Rum padşahı Sultan Məhəmmədin Firəngdəki Mora tərəfinə qoşun çəkməsi və o diyarı fəth etməsi haqqında söhbət**

Bu il Rum padşahı Sultan Məhəmməd qalibiyyətli ordu və sayı qarışqalar qədər olan əsgərlərlə hərəkət bayrağını Moraya doğru qaldırdı. Bəhram kimi qəhredici qoşunlar Firuzşəhr[1006] ətrafında cah-calalla dayandıqda, ordunun toplanması və döyüşkən bahadırların mükəmməl olması üçün orada gözlədilər. Ondan sonra qələbə bayraqlarını Yengişəhər yolundan keçirib, Silifke[1007] qalasını əhatəyə alaraq savaşa və döyüşə başladılar. Qaragün kafirlər çarəsizlik üzündən aman istəyib qalanı təslim etdilər.

Sultan onları həbs edib Korfus[1008] qalasına yönəldi. Yol əsnasında Mence (?) qalasını və Toxmaq-hisarı[1009] fəth edib Korfus ətrafında dayandılar. O diyarın kafirləri əvvəlcə müharibəyə başladılar. Lakin Rum əsgərlərinin rəşadətinin cüzi bir hissəsini müşahidə etdikdən sonra qalanı təslim etdilər və oranı sultanın məiyyətinə təhvil verdilər. Balubedre (?) şəhərinin ətrafı dəniz kimi gurlayan ordunun dayanacaq yeri olduqda, o şəhərin əhalisi onları qarşılamağa tələsib sultanın əmrlərini və qadağalarını razılıqla qəbul etdilər. O şəhərlər adlı-sanlı sultanın qüdrət əlinə keçdikdən sonra qışlamaq üçün Üsküp şəhərinə doğru yüyən çevirdi[1010].

O əsnada xəbərçilər sultana ərz etdilər ki, "Las vilayətin yerdə qalan hissəsi sultan cənablarına itaət və tabeçilik məqamında sabitqədəmdirlər və ali dərəcəli padşahın qədəmlərinin intizarını çəkirlər". Ona görə də sultan, vəziri-əzəm Mahmud paşanı Anadolu ordusu ilə Las diyarına yolladı. Onlar Sofiya yolundan o diyara yönəldilər. O məkandan qalxıb, birdəfəyə gecə və gündüz yol gedərək tam vaxtında pozğun kafirlərə yetişdilər və asimandan gələn fəlakətlər və qəfil bəlalar kimi o pərişan taleli qövmün başının üstünü aldılar. İlk həmlədə kafirlərin qalalarından olan iki möhkəm hasarı ələ keçirdilər və oradan hərəkət bayrağını Semendire tərəfə qaldırdılar. Ora Tuna çayı kənarında yerləşən, mükəmməl səviyyədə mətanətli, istehkamlı və son dərəcə möhkəm bir qala və şəhərbənddir. Pozğun kafirlərin o qalanın möhkəmliyinə ümidi böyük idi. Dəniz kimi Sav və Tuna çayları onun üçün su ilə dolu dərin xəndək vəzifəsini yerinə yetirirdi.

Beyt

"Xəndəyi müdriklərin fikri kimi dərin,
Bürcünün gözətçisi ay ilə yoldaş".

---

[1004] Həzarcərib – İranın Mazandaran vilayətinin inzibati mərkəzi olan Sari şəhəri yaxınlığında yaşayış məntəqəsidir və hal-hazırda Sari şəhristanının 14 nahiyəsindən birini təşkil edir.
[1005] Nüsxələrdə "daş" (səng) əvəzinə "tüfəng" yazılmışdır.
[1006] Bu adla Kosovanın cənubundakı Ferizovik şəhərinin nəzərdə tutulması mümkündür.
[1007] Silifke əvəzinə Filke olmalıdır *(İ.H.Uzunçarşılı. Osmanlı tarihi. II. c., s.43).*
[1008] Korent (Korinf) olmalıdır *(Öztürk, şərhlər, s.349).*
[1009] Toxmaq-hisar – Yunanıstanın Mora yarımadasında qala.
[1010] 1458-ci ildə baş vermiş bu yürüş zamanı Osmanlı sultanı Tarsos, Flius, Akrivi, Roupeli, Korinf, Patras, Vostitsa, Kalavrita, Afina və s. kimi şəhərləri ələ keçirmişdi. Burada adı çəkilən Üsküp, Makedoniyanın paytaxtı olan Skopye (Üsküp) şəhəri deyil, Kırkkilsənin (Kırklarelinin) şərqində yerləşən bir məntəqədir *(Nəvai, şərhlər, s.545-546).*

Rum əsgərləri qalanı əhatəyə aldılar. Kafirlərin süvarilərindən və piyadalarından [ibarət] bir dəstə müharibə əzmi ilə irəli gəldi və başdan ayağa qədər günahkarlar kimi özlərini zəncirə, cəbbəyə və cövşənə bürüyüb döyüşə və savaşa hazır oldular. Rum əsgərlərindən bir dəstə əzmkarlıq atını cövlana gətirib onlara həmlə etdi. Taleyin üz döndərdiyi o köhnə kafirlər kaftarların mağaraya sığındıqları kimi qalaya pənah apardılar. Mücahidlərin[1011] onlara qılınc uzatmasının əvəzini çıxmaq üçün qalanın içindən təhdid və hədə ilə bildirdilər ki, "bu bir neçə gün ərzində kralın[1012] tərsinə dönmüş sancağı və bayrağı bu qalanı himayə etmək və onu qorumaq üçün gəldikdə, müsəlman qoşunu döyüşməyə güc tapa bilməyərək səba və şimal küləkləri kimi fərar edəcək". Amma iman və salehlik əhlinin doğru cavabı qılıncların və mizraqların dili ilə bu mənanı açıqlayıb izah edirdi ki, düşmənlərin əcəli çatmış və tənəzzülə üz qoymuşlar, onların bəxt ulduzu ən aşağı dərəcəyə enərək zavala və süquta uğramışdır; zəlalət əhlinin köməyi və azğın kralın yaxınlaşması onların işini yaxşılaşdırmayacaq və onların əməllərinin, amallarının səhifəsi üzərində darmadağın edilmək və cəzalandırılmaq buxovundan başqa bir şey özünü göstərməyəcək.

Qazilər bir həftə müddətində o kafirlərin həyati ehtiyaclarını kəsdilər, taxılların və meyvə ağaclarının kəsilməsində həddən artıq böyük səy göstərdilər. Mühasirə günləri uzandı. O əsnada Rumelinin mötəbər əmirlərindən İshaq bəy və Əli bəy elçi kimi o dövlətsiz kafirlərin yanına gedib əqli və nəqli dəlillərlə onları yola gətirməyə çalışdılar. Amma pis əməlli kafirlər savaşdan əl çəkmədilər. Ertəsi gün Rum ordusu döyüşə başladı və Semendirenin xəndəyi və qala divarı üzərindən aşaraq bazarın içinə daxil oldu. O dinsiz kafirlərin əksərini qətlə yetirdilər. Semendirenin fəthindən[1013] sonra hərəkət bayrağını Gözəlcəhisar[1014] tərəfə qaldırdılar. Qısa zamanda o qalanı da zəbt etdilər. O əsnada Sivricəhisarın fəthi də müyəssər oldu. Ən mötəbər mədənlər olan gümüş və mis mədənləri ələ keçirilib sultan üçün zəbt və mühafizə edildi.

Oradan Mahmud paşa tərtib olunmuş ordu və növrəstə bahadırlarla Gögərçinlü (Qolubats) qalasına yönəldi. Ora çox möhkəm və sağlam bir qala idi, uca dağ başında yerləşirdi. Mətanət və möhkəmlikdən ötrü onu üç mərtəbə etmişdilər. Hər mərtəbədə müharibə və mücadiləyə hazırlıq görülmüşdü. Onlar oranın fəthinin heç vəchlə mümkün olmadığına və olmayacağına güvənir və ümid edirdilər. Çoxlu çarpışma və vuruşmadan sonra aşağı mərtəbənin mühafizəçiləri əlacsızlıq üzündən təslim oldular. Qala qülləsinin qoruyucuları da susuzluqdan cana doyub, çoxlu tuluğları möhkəm zəncirlərə bağlayaraq Tuna çayına sallamışdılar və min möhnət və təşvişlə yuxarıya bir az su çəkə bilirdilər. Rumilər hücum edib tuluğları onlardan aldılar. Ona görə də kafirlər əfv və aman diləmək üçün çoxbilmiş paşanın yanına elçilər göndərdilər. Paşa onların günahından keçdi və onlar qalanın açarlarını təslim etdilər.

O əsnada bir dəstə Rum əsgəri Tuna çayından keçib, Engirüsə tabe olan bir diyarı qarət etdi. Qəflətən, bu zaman kafirlərin sərdarlarından və adlı-sanlı cəngavərlərindən iki yüz nəfər başdan ayağa polada qərq olmuş halda gəlib çatdılar və çayı keçmək çətin olduğu üçün məyusluq və pərişanlıqla geri döndülər. Mahmud paşa qalanı tutub qeyri-məhdud qənimətlərlə ali məqamlı padşahın hüzuruna yollandı. Engirüsə tabe olan bir qalanın qarşısında dayandılar. Murad adlı birisinin [başçılığı] ilə oranı tutmağa yönəldilər. Oranın əhalisi xəbərsiz olduğundan onlar yubanmadan və çətinlik çəkmədən qalanı ələ keçirdilər. O qalanın ətrafında yerləşən və çeşidli mallarla, pəri çöhrəli gözəllərlə dolu olan böyük və məskun vilayətin tamamını tarac etdilər, əsir aldılar və yağmaladılar. Oradan bir müddət sonra Tuna və Sav çayları arasındakı Macu[1015] vilayətinə basqın etdilər. O məmləkətin bütün nəfis əşyalarını, əsirlərini, mallarını və ay üzlülərini [özləri ilə] apardılar. Ora çox geniş bir məmləkət olub, qılmanlar və gözəl cariyələrlə dolu idi. Hamısını qarət və əsir etdilər, heyvanları və s. malları talamaqla məşğul olub, qənimətləri Tuna çayı sahilinə gətirdilər. Bu qoşunu nəzarətdə saxlamaq üçün təcrübəli bir sərkərdə olan və kafirlərlə böyük döyüşlər aparmış, onlardan saysız qənimətlər ələ keçirmiş Məhəmməd bəy Minnətoğlunu kama çatmış qazilərlə birlikdə ön dəstə təyin edib, onları bəzi çətin yollardan keçərək oraya getməyə göndərdilər. Çoxlu qənimətlər qarət etdikdən sonra onlar

---

[1011] Mücahid – din yolunda vuruşan islam döyüşçüsü.

[1012] Macarıstan kralı Matyas Koron. O, Yanoş Hunyadinin ikinci oğlu idi *(Nəvai, şərhlər, s.548).*

[1013] Rezava şəhərinin, Vişevats, Zrnov, Qolubats qalalarının fəth edildiyi bu yürüş zamanı Semendire qalası müqavimətsiz təslim olmuşdu *(Nəvai, şərhlər, s.547).*

[1014] Gözəlcəhisar – Belqrad yaxınlığındakı Havale qalası nəzərdə tutulur.

[1015] Başqa qaynaqlara görə: Maçu (bax: *Tursun Bey. Fatih'in Tarihi – Târih-i Ebü'l-Feth. Haz. Ahmet Tezbaşar. Tercüman Yayınları, s.79*).

paşanın əzəmətli ordugahı önündə Tuna çayını keçib bir-biriləri ilə birləşdilər. Təsadüfən, qənimət toplayanların arxasından Engirüs qoşununun təxminən əlli min nəfər mükəmməl əsgəri gəlməkdə idi ki, bəlkə, qənimətləri Tuna çayının bəzi çətin keçilən yerlərində geri ala bilsinlər və məmləkəti xaraba qoymaqlarının əvəzini onlardan çıxa bilsinlər. Lakin gəlib çatdqları zaman onlar artıq çayı keçmişdilər. Kral ordusu nəinki qənimətləri geri ala bilmədi, həm də kafirlər qoşunu sürətli yürüşün ucbatından zay olaraq xeyli heyrətə və hədsiz peşmançılığa düşüb söylədilər:

“Qurdun məqsədi nə idisə, onu apardı,
Onların hay-küyü fayda vermədi”.

O qoşunda sultanın xümsünü tutmuş mücahidlərdən biri olan bu hekayələrin nəqledicisi və bu rəvayətlərin söyləyicisi cansızdan və canlıdan, çeşidli mallardan, nağd pullardan və əmtəələrdən, heyvanlardan və s. ibarət qənimətlərin təfsilatını həqiqətəuyğun bir şəkildə rəvayət edərək bildirmişdir ki, o məbləğin beşdə bir hissəsi belə böyük həcmdə idi[1016]. Sultan həmin beşdə bir hissəni seyidlərə və xümsə layiq olanlara verib səadət və uğurla geri döndü.

## 861-Cİ İLDƏ (29.11.1456 – 18.11.1457) BAŞ VERMİŞ HADİSƏLƏR VƏ ZAMANIN DƏYİŞİKLİKLƏRİNDƏN BƏZİLƏRİ HAQQINDA SÖHBƏT

Bu il rəbiülaxır [ayının] 3-də (28.02.1457) Mirzə Babur Üləngi-Radkan tərəfə hərəkət etdi. Bir neçə gün həmin ürək açan məkanda heyvan ovlamaq və quş uçurmaqla məşğul oldu. Qəflətən xoşbəxt hökmdarın çox bəyəndiyi ağ şahinin dırnağı sındı. Bu məna onun nurlu könlünə ağır gəldi və təcili surətdə müqəddəs Məşhədə doğru qayıtdı. Oraya gəlişi günündə bu beyti dilə gətirdi:

Beyt

“Şəraba tövbə etdim və bahar gəldi,
Saqi, tövbəmi qırmağı arzu edirəm”.

Xidmətçilərə eyş-işrət büsatı qurmağı tapşırdı. Ləzzətli qədəhləri gül üzlü saqilərin əlindən aldı. O cahandarlıq binasının qurucusu seşənbə günü, rəbiüssani [ayının] 25-i (22.03.1457) səhərində sevinc və səadət halında Məşhəd Çaharbağında kəcavəyə oturub bir saat seyrə çıxdı və geri döndükdən sonra dövlət taxtında qərar tutdu. Qəflətən hökmdarın halı dəyişdi və bəzi əmirlərə hirslənib, qəzəblə ayağa qalxaraq hərəmsaraya getdi. Məclisdəkilər dedilər ki, hökmdar bərk sərxoşdur. Bilmədilər ki, o, əcəlin əlindən ölüm qurtumunu içəcəkdir. Həmin günün çaşt vaxtında qürurun qəmli məkanından (bu dünyadan) sevinc sarayına (axirət aləminə) köçdü.

Alinəsəb əmirlər onun cəsədini İmam Rza məqbərəsinin (Rövzeyi-Rizəviyyə) yanındakı günbəzdə dəfn etdilər. Bilikli təbiblər onun zəhərləndiyini hiss etdilər. Fərasətli müdriklər onun səkkizinci imamın yaxınlığında [basdırılmış] olmasını bu müddəaya dəlil göstərdilər[1017].

Mirzə Baburun can odlayan [ölüm] hadisəsi baş verən gün əmirlər və dövlət ərkanı onun oğlu Mirzə Şahmahmudu[1018] səltənət taxtına əyləşdirdilər. Əmir Hüseynəli Herat tərəfə hərəkət etdi. Böyük qardaşı Əmir Şeyx Əbu-Səid isə bəzi məmləkət məsələlərindən ötrü Sərəxs tərəfə getdi. Şeyxzadə Pirqivam[1019], Mirzə Səncəri çağırmaq üçün Mərvə yola düşdü. O böyük hadisədən sonra on səkkiz gün içində Mirzə Şahmahmud darüssəltənə Herata tərəf hərəkət etdi. Yol əsnasında Şeyxzadə Mərvdən gəlib çatdı və ərz etdi ki, Mirzə Səncər baş qaldırmaq niyyətindədir və başını heç kimin itaət boyunduruğuna soxmaq istəmir. Heratdan da xəbər gətirdilər ki, oranın daruğası Əmir Rəcəb, Mirzə Baburun ölüm xəbərini eşitdiyi gün elə iztirablı və sərsəm hala qapılmışdır ki, o şəhərdə məhbus olan Mirzə İbrahimi mühafizə etməkdən qafil qalmışdır. Şahzadə də bunu qənimət bilib özünü həbsdən xilas etmiş və hərəkət yüyənini Mürğab çayı kənarına sarı çevirmişdir.

---

[1016] Ənənəyə görə, hərbi qənimətin beşdə bir hissəsi sultana çatırdı *(Nəvai, şərhlər, s.551).* Bundan başqa, seyidlərə verilən vergi də xüms adlanırdı. Bu hadisənin təsvirinin hansısa Osmanlı mənbəyindən götürüldüyü bəlli olur.

[1017] İmam Rza da zəhərləndirilərək öldürülmüşdü *(Nəvai, şərhlər, s.553).*

[1018] O, Mirzə Baburun tək oğlu idi və 11 yaşı vardı *(Nəvai, şərhlər, s.553).*

[1019] Şeyxzadə Pirqivam ali ruhani vəzifəsi olan sədr mənsəbini daşıyırdı *(Nəvai, şərhlər, s.553).*

Mirzə Şahmahmud cəmadiyüləvvəl [ayının] 26-da (21.04.1457) Muxtar bağına gəlib bir neçə gündən sonra Zağan bağına köçdü. Elə bu arada Əmir Şeyx Əbu-Səid Sərəxs vilayətindən gəlib, [camaata] zülm və əziyyət verməyə başlayaraq Herat şəhərinin sakinlərindən hər adambaşına çoxlu qızıl verməyi tələb etdi. Hələ bu məbləğ yığılıb qurtarmamış onların üzərinə yeni vergilərin yazılmasını əmr etdi. Mühəssillər (vergi yığanlar) şiddətə başlayıb xalqı işgəncəyə çəkdilər. Biçarələr yalvarış əlini qüdrətli Tanrının dərgahına açıb özlərinin [bu vəziyyətdən] xilas olmalarını xahiş etdilər. Elə bu zaman məzlumların dua oxu hədəfə dəydi. Əmir Şir Hacı cəmadiyülaxir [ayının] 21-də (16.05.1457) Şahmahmudu şəhərə daxil edib darvazaları bağladı. Onun buyruğu ilə bazarlarda car çəkdilər ki, adambaşı vergidən heç kimə bir füls belə verməsinlər və verdiklərini də geri istəsinlər. Şeyx [Əbu-Səidin] nökərlərinin malik olduqları hər şey soyğuna və taraca getdi. O gecə camaat mühafizə işləri ilə məşğul oldu və Əmir Şeyx Əbu-Səid bayırda qaldı. O, öz qardaşı Əmir Hüseynəli ilə sübhün açılmasına yaxın Mürğab çayı kənarına yola düşdü. Əmir Şir Hacı əmirlərdən, əsgərlərdən və rəiyyətdən [ibarət] çoxlu adamla birlikdə düşmənlərin ardınca çapıb Doqquz-ribat yaxınlığında onlara çatdı. Yaramazlığı özünə şüar etmiş Şeyx Əbu-Səidin etdiyi zülmün uğursuzluğu onun öz həyatına şamil oldu. O, ələ keçirildi və qəzavü-qədər əli o mərdimazarın həyat büsatını bükdü.

Həmin əhvalatın baş verdiyi əsnada bir-birinin ardınca Mürğab çayı kənarından xəbər çatdı ki, kama çatmış şahzadə Mirzə İbrahimin bayrağının kölgəsində çoxlu qoşun toplaşaraq, darüssəltənə Herata doğru irəliləmək əzmindədirlər. Əmir Şir Hacı düşündü ki, tərxan [qəbiləsinin] əmirləri Məhdi-Ülya Gövhərşad bəyimin razılığı ilə Mirzə İbrahimi Mirzə Şahmahmuddan üstün tutacaqlar və döyüş günü o tərəfə meyil edəcəklər. Buna görə də o, Pəhləvan Hüseyn Divanə ilə ittifaqda tərxanlıların qətlinə qərar verdi. Bir gün məşvərət etmək bəhanəsi ilə o qövmü Zağan bağındakı köşkə çağırdı. Əmir Əhməd Firuzşah malik olduğu fərasət sayəsində cənab əmirin niyyətini başa düşərək qaçıb aradan çıxdı. Onun yoxa çıxmasından sonra Əmir Şir Hacı və Pəhləvan Hüseyn Divanə tərxanlı əmirlərinə qəsd etdilər. Əmir Üveys Tərxan canının qorxusundan Əmir Şir Hacının qarnına bıçaq vurdu. O cənab üzüqoylu yıxıldı. Əmir Üveys öz oğlu Yusif Tərxan, Xosrov Tərxan və Mahmud Tərxanla birlikdə dərhal öldürüldü. Həmin gün Pəhləvan Hüseyn Divanə Xəvafa[1020] yollandı. Onun soyurğalı orada idi. Yol əsnasında Əmir Əhməd Firuzşahla rastlaşıb o cənaba şəhidlik şərbətini içirdi. Əmir Şir Hacı əmirlərin qətlindən sonra Mirzə Şahmahmudla Məhdi-Ülya Gövhərşad bəyimi İxtiyarəddin qalasına gətirib öz yarasını müalicə etməklə məşğul oldu.

Mürğab çayı kənarında kama çatmış şahzadənin bayrağının kölgəsində toplanmış uğurlu qoşun hərəkət bayrağını darüssəltənə Herata doğru qaldırdı. Əmir Şir Hacı bu xəbəri eşidib Mirzə Şahmahmudun üzəngisi həndəvərində Muxtar bağına tələsdi. Mirzə İbrahim seşənbə gününün səhər vaxtı, rəcəb ayının 7-də (31.05.1457) o diyarın ətrafına çatdı. Mirzə Şahmahmud hərəkət yüyənini müqəddəs Məşhəd səmtinə döndərdi. Əmir Şir Hacı isə Nərətu qalasına qaçdı. Müzəffər bayraqlı şahzadə günorta vaxtı Muxtar bağına gəlib səltənət taxtı üzərinə qədəm qoydu. Xalq üçün ədalət süfrəsi açıb, zülm və ədalətsizlik qaydalarının aradan qaldırılacağını vəd etdi.

Bir neçə gün bu minvalla ötdükdən sonra Məşhəd tərəfdən ardıcıl xəbərlər gəldi ki, Mirzə Şahmahmud qeyri-məhdud qoşunlar toplamış və hərəkət bayrağını darüssəltənə Herata doğru qaldırmışdır. Ona görə də şaban ayının (24.06-22.07.1457) ortalarında Mirzə İbrahim müxaliflərlə döyüşmək üçün hərəkətə keçdi. Əmir Şahməlik karvansarası (ribatı)[1021] yaxınlğında o, Mirzə Şahmahmudla üz-üzə gəldi. Böyük bir savaş oldu. Əvvəlcə Baburilər (Mirzə Şahmahmudun tərəfdarları) üstünlük qazansalar da, axırda Əhməd Tərxanın səyi ilə məğlubiyyətə uğradılar. Mirzə Şahmahmud yenə də Məşhədə yollandı. Mirzə İbrahim qəhr olmuş düşmənlər üzərində zəfər və qələbə qazanmış halda Herata döndü.

Qəribə hadisələrdən biri odur ki, düşənbə gününün çaşt vaxtında, şaban [ayının] 25-də (13.07.1457) Herata xəbər gəldi ki, fəth və zəfər yeli Mirzə Şahmahmudun bayrağının pərçiminə əsmişdir. Bir müddət sonra başqa birisi gəlib dedi ki, Mirzə İbrahim qələbə qazanmışdır. Günorta vaxtı fələk iqtidarlı bir padşah

---

[1020] Xəvaf – Xorasanda, Nisa yaxınlığında yerləşən bir şəhər idi (bax: *Əbdürrəşid əl-Bakuvi. Kitab təlxis əl-asar və əcaib əl-məlik əl-qəhhar /Abidələrin xülasəsi və qüdrətli hökmdarların möcüzələri/. Ərəbcədən tərcüməsi, müqəddimə və şərhləri Z.M.Bünyadovundur. Bakı, 1992, s.91*).

[1021] Kusuyə qəsəbəsi yaxınlığındadır *(Nəvai, şərhlər, s.556).*

olan Sultan Əbu-Səidin elçisi şəhərə gəlib söylədi ki, sabah səhər hökmdarın bayrağı gəliş kölgəsini bu diyara salacaqdır. Bu xəbərlərdən sonra Sultan İbrahim hərəkət bayrağını Bəlx tərəfə qaldırdı.

Səadətli sultan (Əbu-Səid) Səmərqənd taxtına oturmasının başlanğıcından bəri həmişə Xorasanı, bəlkə də, İranın digər məmləkətlərini fəth etməyin nəqşini özünün xəyal lövhəsi üzərinə çəkirdi. O, Mirzə Baburun ölüm xəbərini eşidəndən sonra həmin istəyi daha da artdı. O, səhra qumundan daha artıq bir ordu ilə Ceyhundan keçdi. Bəlx hakimi Əmir Şeyx Hacı, Sultan Əbu-Səid qarşısında itaətini izhar etdi, daha sonra isə Mirzə İbrahim sultanın yanına söz bilən elçilər göndərib ərz etdi:

- Mən də o dərgahın (Mirzə İbrahimin dərgahının) dostlarından və o bargahın xidmətkarlarındanam. Əgər o həzrət (Mirzə İbrahim) bu diyara gəlsə, Bəlxi ona təslim edərəm.

Ona görə də Mirzə İbrahim Bəlxə yönəldi. O məkrli qəddar (Əmir Şeyx Hacı) isə Sultan Əbu-Səidin ordusu ilə anlaşmışdı və təmənna qələmi ilə aldatma surətini xəyal lövhəsi üzərinə çəkmişdi.

Sonra yol əsnasında ali məqamlı padşahın ordusu göründü. Qılınclara və mizraqlara əl atdılar. Mirzə İbrahim qorxudan iki parça olmuş ürəyi ilə qaçış yolunu tutdu. Amma Əhməd Tərxan qızğın bəbirə və coşqun şirə dönüb, müxalifləri vəhşi ov heyvanı kimi qovaraq nizə və ox zərbəsi ilə düşmənin ciyərini deşdi. O, Mirzə İbrahimi xilas edib Herata çatdırdı.

Sultan Əbu-Səid təcili surətdə hərəkətə gəlib şaban [ayının] 25-də (13.07.1457) çoxsaylı ordu ilə Saq-Salman kəndində[1022] dayandı. Ertəsi gün Mavəraünnəhr ordusu ilə şəhər bağına təntənəli surətdə gəldi. Əhməd Yasavul möhkəm bir hasarı olan İxtiyarəddin qalasına güvənib müxalifliyə başladı. Bu üzdən onun yanına elçilər göndərib ona yüksək mənsəblər verəcəyini vəd etdi. Əhməd Yasavul dedi:

- Bu evi vəlinemətim mənə tapşırmışdır. Mümkün deyil ki, mən qalanı digər birinə təslim edim.

Bu xəbər alinəsəb padşaha çatdıqda mühasirə hazırlıqlarının görülməsini əmr etdi. Qalibiyyətli qoşunlar qalanı əhatəyə aldılar. Ora elə bir qaladır ki, hündürlükdə dövr edən fələklə bərabərdir və ucalıqda ulduzlarla sirdaşdır.

Şeir

“Möhkəmlikdə xəsis kişinin ovcu kimi bağlıdır,
Qaranlıqda şər yaxanın ürəyi kimi dibsiz.
Onun içinə hirsli div girə bilməz,
Onun üzərindən əsən külək ötə bilməz.
Dövr edən günbəzdən (səmadan) ona elə baxmaq olar ki,
Yerdən dövr edən günbəzə (səmaya) baxılan kimi.
Fələk yüz hiylə ilə ona zərər verə bilməz,
Onun üzərinə qona bilməz pəri yüz əli ilə”.

O əsnada Bəlx tərəfdən xəbər gəldi ki, Mirzə Əbdüllətifin övladları[1023] qiyam qaldırmışlar. Ona görə də səadətli sultan (Əbu-Səid) Qazı Qütbəddin Əhmədi, bəzi başbilənləri və əhalini çağırıb dedi:

- Mən istəyirdim ki, Heratı paytaxt edim. İndi isə Səmərqənddə bir neçə hadisə baş verib və zəruridir ki, o diyara yola düşüm. Baharın əvvəllərində, gecə-gündüz bərabərliyi zamanı [yenidən] Herata gələcəyəm.

Sonra şəvval [ayının] 9-da (30.08.1457) [Əbu-Səid] səadət və uğurla Bəlx tərəfə hərəkət etdi və bir sıra əmirləri mənqəlay [təyin] etdi. Onlar Bəlx şəhəri ətrafında Mirzə Əbdüllətifin oğlu Mirzə Əhmədlə döyüşüb onu o biri dünyaya göndərdilər. Qardaşı Mirzə Məhəmməd Cuki isə xilas oldu. Sultan Əbu-Səid rahat bir şəkildə Bəlxdə qışlaq etdi.

Mirzə İbrahim bir müddət Xəvaf və Baxərz[1024] vilayətində sərgərdan oldu. Sultan Əbu-Səidin çıxıb getdiyini eşitdkdə bir neçə gün sevinc nağarası döydü və səmərqəndlilərin [ağalığı] zamanında satqınlıq etmiş bütün adamları cəzalandırdı. Əhməd Tərxanı çoxlu qoşunlarla Herata göndərdi. Həmin günlərdə Nərətu qalasında qəribə bir hadisə üz verdi.

Bu sözün bəyanı belədir ki, Əmir Şir Hacı Herata [Sultan Əbu-Səidin hüzuruna] getdiyi vaxt o qalanı öz inanılmış adamlarından birinə tapşırmışdı. Bir gün axşama yaxın Pirəkə adlı bir yasaqçı qalanın içinə bir

---

1022 Saq-Salman və ya Saq-Süleyman – Herat şəhərindən 8 mil uzaqda yerləşir *(Öztürk, şərhlər, s.357)*.
1023 Yəni Mirzə Əhməd və Mirzə Məhəmməd Cuki *(Nəvai, şərhlər, s.558)*.
1024 Baxərz – İranın şimal-şərqində, Cam şəhərindən cənubda yerləşən tarixi yer adı.

neçə qoyun gətirdi. Söhbətləşdikdən sonra xahiş etdi ki, gecə orada qalsınlar. Sonra onun xahişi qəbul edildi. O, qalaya daxil oldu. Gecənin bir hissəsi keçəndən sonra yanındakı kəməndlə öz dostlarını [qala] divarından yuxarı çəkdi və onlarla birlikdə cürət qılıncını sıyırıb qəfil bəla kimi kutvalın üzərinə getdi. O biçarə bir neçə yara alıb hiylə ilə fərar etdi. Pirəkə o qalanı zəbt etdi.

Bu il rəiyyətdən zorla üç dəfə vergi alındı: əvvəlcə Mirzə Şahmahmud, ikinci dəfə Mirzə Sultan İbrahim, üçüncü dəfə isə Sultan Əbu-Səid [tərəfindən]. Məmləkətin xarablığı o dərəcəyə çatdı ki, mühəssillər (vergi yığanlar) qoşun üçün qızıl və mal toplayırdılar, daruğalar kəndlərdə və tarlalarda oturub daruğa haqqı (daruğaganə) yığırdılar, yasaqçılar qarət və tacacı həddən aşırmışdılar və heç kimin gözünün yaşına baxmırdılar. Bu səbəbdən çoxlu dağıntılar baş verdi.

**Ölümlər**

Mirzə Babur ibn Mirzə Baysunqur ibn Şahrux padşah ibn Sahibqiran Əmir Teymur Kürəkan. O həzrət dərviş ürəkli və xoş xasiyyətli bir padşah idi. Vəznli təbi və inci kimi qiymətli sözləri vardı. Səxavətdə Hatəm Taiyə[1025] tay idi. Zərərsizliyi üzündən onun əsgərləri rəiyyət üzərində öz ağalıqlarını qurmuşdular.

Əsgərlərinin zülmünün səbəbi o idi ki, Şahrux padşah Reydə dünyadan köçdüyü zaman Əmir Hinduka, Mirzə Babura demişdi:

- Sənin qardaşların şəhərləri ələ keçirmişlər. Əgər mənim sözümü razılıq qulağı ilə dinləsən, mülk sənə keçər.

Mirzə Babur dedi:

- Bəyan et!

Cavabında ərz etdi:

- İlk öncə alçaq adamları yüksəlt! Çünki mötəbər şəxslər sizə tabe olmazlar. İkincisi, ifrat dərəcədə bəxşiş payla! Üçüncüsü, qoşunu qarətdən və təcavüzdən çəkindirmə! Dördüncüsü, adamlarına zərər yetirmə ki, onlar səndən arxayın olsunlar. Məmləkət sənin ixtiyarına keçdikdən sonra isə bu əməlləri tərk edərsən.

Mirzə Babur onun sözünü qəbul etdi. Amma [ölkəni] ələ keçirdikdən sonra [bu işləri] aradan qaldırmaq istəsə də, faydası olmadı. Çünki bu qayda davamlı hal almışdı. Şairlərdən biri[1026] onun [ölüm] tarixi haqqında demişdir:

Nəzm

“Babur xanın hökmranlıq günəşi qalmadı,
Belə bir günəş günəşdə gizləndi.
Rəbiüssani ayında və bahar fəslində,
Saqi laləni ürək qanı ilə doldurdu.
Çərxi-fələyə dedim ki, ciyərlər paralandı,
Göz yaşından ətək inci ilə doldu.
Bu nə haldır və bu nə tarixdir?
Dedi ki, “əliaçıq sultan Baburun ölümü”dür”[1027].

Həmçinin bu hadisə haqqında demişlər:

Şeir

“Cahan mülkünü qılıncla alan bir aslanın,
Qəflətən düşdü könlünə cənnət meyli.
Hər kəs vəfat tarixi soruşarsa,
Deyərsən ki, başını qoydu “Şah Babur xan”[1028].

[1025] Hatəm (Hatəm Tai) – VI-VII əsrin əvvəllərində yaşamış ərəb qəbilələrinin başçılarından və şairlərindən biridir. Guya o, dövrünün ən varlı və ən səxavətli adamı imiş. Şərq ədəbiyyatında öz səxavəti ilə məşhur olan adam rəmzi kimi işlədilir *(A.M.Babayev. Azərbaycan klassik ədəbiyyatında işlədilən adların və terminlərin şərhi. Bakı, 1993, s.241; İ.Pala. Ansiklopedik divân şiiri sözlüğü, s.198).*

[1026] Bu maddeyi-tarixin müəllifi tarixçi Əbdürrəzzaq Səmərqəndinin qardaşı Şərifəddin Əbdülqəhhardır *(Nəvai, şərhlər, s.561).*

[1027] “Mövti-sultani-müəyyid Babur” = 861 h.

[1028] Misranın məzmununa uyğun olaraq “Şah Babur xan” ifadəsinin baş hərfini, yəni “şin” hərfini bir kənara qoysaq, yerdə qalan hərflərin əbcəd hesabı ilə cəmi 861 edir *(Nəvai, şərhlər, s.561).*

Yenə digər birisi deyir:

“Qəflətən tale Allahın qüdrətindən,
Babur xanın tacını yerə saldı.
Peyğəmbərin tarixinin 861-ci ilində,
Rəbiülaxırın 26-da (23.03.1457)”.

Səltənətinin müddəti on il, məmləkəti Xorasan idi.

Şahrux padşahın nikahlı arvadı Gövhərşad bəyim bu il qətlə yetirildi. Onun qətlinin səbəbi budur ki, Sultan Əbu-Səid Herata gələn vaxt fəsadçılar ərz etdilər ki, Mirzə İbrahimin qasidləri Gövhərşad ağanın yanına gəlirlər və ondan xəbərlər alıb gedirlər. Bu üzdən o xeyirxah və ədalətli xanımı qətlə yetirdi. Heratdakı bir mədrəsəni və Məşhəddəki bir cümə məscidini o tikdirmişdir.

**Rum diyarında baş vermiş hadisələr və Rum padşahı Sultan Məhəmmədin Engirüs diyarına qoşun çəkməsi haqqında söhbət**

Bu il Rum padşahı Sultan Məhəmməd saysız bir ordu ilə Engirüs mülkünü fəth etmək niyyəti ilə Sofiya çölü tərəfə hərəkət etdi. Belə bir izdihamlı ordunun hərəkətindən pozğun kafirlərin bədəninə titrəmə düşdü.

Şeir

“Güclü və möhtəşəm sultanların heybətindən,
Sülh və hərb çarəsi düşünməkdə aciz qaldılar.
Sərhəddə oturan igidlər qaçmaq zamanında,
Bərk küləyin zərbəsini yemiş çör-çöpə döndü”.

Bosna kralı iş bilən elçilərini bol töhfələrlə sultanın hüzuruna göndərdi və tam tabeçiliyini və itaətini səmimi surətdə ərz edərək bildirdi ki, “Semendire qalasını heç bir çətinlik olmadan sultanın mülazimlərinə təhvil verərəm, lakin onun əvəzində Bosna sərhədindəki Sərhəngi qalasını həzrət sultandan təmənna edirəm”[1029]. Sultan o qalaya mühafizlər göndərdi və Bosna əvəzində qalanın təslim edilməsindən dini və mülki baxımdan boyun qaçırıb Ədirnə tərəfə qayıtdı.

O əsnada xəbər çatdı ki, şimaldakı Qara dəniz kənarında, Anadolunun Bolu vilayəti yaxınlığında olduqca möhkəm bir qala var[1030], lakin oraya tabe ərazi çox kiçikdir və mənfəəti azdır. Məhəmmədi günəşin o qalanın ətrafına və yan-yörəsinə hidayət nuru çatdırmasına baxmayaraq, hələ də qala bir mərkəz kimi küfr və zəlalət zülməti içində qalmışdır. İslam qeysərlərinin ata-babaları məkanının kiçikliyi, yollarının və keçidlərinin çətinliyi üzündən o qaladan ilbəil xərac almaqla qənaətlənmişlər. Sultanlar, ardıncıl olaraq, o bölgəyə hücum etməmək barədə bir-birini təkrarlamışlar. Amma o qalanın səhra tərəfdən və dəniz üzərindən keçən yollarında quldurlar basqınlar həyata keçirirdilər və o zamana qədər bu fitnə-fəsadı həmişə sultanlardan gizlətmişdilər.

Sultan müsəlmanların mallarına və canlarına zərər verən və külli fitnə-fəsada səbəb olan bu cüzi hadisəni aradan qaldırmaq üçün islami qeyrət və şərəf hissi ilə hərəkətə gəldi. Müqəddəslikləri görən xatirinə belə bir ağıllı fikir gəldi ki, “ədalətli bir vali və hakim üçün istər cüzi olsun, istər külli olsun, pislikləri ortadan qaldırmaq və fitnə-fəsadı yox etmək vacib və zəruridir. Dini və dünyəvi fəsadları aradan götürmək üçün mənfəətin azlığına-çoxluğuna baxmaq məntiqli deyildir və ənənəyə ziddir”. Bu üzdən sultan o məsələni həll etmək niyyəti ilə yürüş hazırlığı görmədən və müzəffər ordunun öz hüzurunda toplanmasını gözləmədən, özünün həmişəki hərəkət sürəti ilə şəxsən yubanmadan və dayanmadan xilafət mərkəzindən (darülxilafət) yola çıxıb gəzmək və ov etmək bəhanəsi ilə xas adamları və aləmin mehvəri olan dərgahın yaxınları ilə o tə-

---

[1029] “Yeni Bosna kralı Stephan Thomaseviçin macarlarla birgə fəaliyyətə başlaması və serb kralının ölümündən sonra, aralıqdakı qohumluq vasitəsilə Semendire üzərində haqq iddia etməsi” və s. kimi xüsuslar Fatehin qəzəbinə səbəb olmuşdu *(Osmanlı tarihi el kitabı, s.77).*

[1030] Hazırda Türkiyənin Qara dəniz sahilindəki Bartin vilayətində yerləşən Amasra qalası nəzərdə tutulur. Həmin zaman bu qala genuyalıların əlində idi. Əslində Amasra 1460-cı ildə fəth edilmişdir *(Osmanlı tarihi el kitabı, s.92-93)*

rəfə yönəldi. Xızırbəy-eli[1031] vilayətindən keçib o həndəvərdə qalanın fəthi üçün əlverişsiz şərtlərin ortadan qaldırılmasına əncam çəkdi.

Əvvəlcə dar yolları açmaq, oranın girişlərini tutmaq, maneələri və əngəlləri kənarlaşdırmaq üçün o qədər təkid etdi ki, bir neçə gün içində o çətin yolların və təhlükəli keçidlərin hamısını hamarladılar və açdılar. Yola dağılmış böyük daşları tamamilə təmizlədilər.

Sultanın gəlişinin səs-küyünü eşidən qala mühafizləri son dərəcə iztirab və əlacsızlıq ucbatından bədən mülkündən və həyat malından ümidlərini tam üzüb əmrləri və qadağaları qəbul edəcəklərini və mülkü təslim edəcəklərini bildirib aman dilədilər. Onlar həyatlarını davam etdirmək üçün qalanı təslim etməkdən başqa tədbir görmədilər. Sadəcə sultanın gəliş xəbəri ilə o qədim küfr bölgəsi islam diyarına çevrildi. Qala və vilayət, hökmlü hakimin və qazının hökmü altına keçdi. O vilayət islamın ən yaxın mötəbər diyarı olan Bolu ölkəsinə birləşdirildi. Müzəffər sultan gəzə-gəzə, sevinc və könül şadlığı ilə xilafət taxtının olduğu yerə yollandı.

Beyt

“Afərin o şəhər bəzəyən camala,
Mərhəba o qala alan taleyə!”

## 862-Cİ İLİN (19.11.1457 – 07.11.1458) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

Mirzə Şahmahmud, Sultan İbrahimlə müharibədən yüyənini çevirib Məşhəd tərəfə getmişdi. Səadətli şahzadə o vilayətdə bir neçə gün qaldıqdan sonra Astarabad tərəfə yollandı. Əmir Baba Həsən[1032] ona yaxşı xidmət göstərdi.

Mirzə İbrahim, Mirzə Şahmahmudun qayıdış xəbərini aldıqda hərəkət bayrağını Cürcana doğru qaldırdı. O, Nisa və Bavərd yolundan Astarabada daxil oldu. O tərəfdən də Mirzə Şahmahmud Xorasan igidləri, Cürcan və Mazandaranın qoşunlarının dikbaşları ilə Mirzə İbrahimin qabağına çıxdı. O əsnada qəribə bir əhvalat və əcaib bir hadisə baş verdi.

Bu sözün bəyanı odur ki, o zaman Cürcan valisi olan Əmir Baba Həsən Qarqın mazandaranlıları çox sıxışdırırdı. Bu səbəbdən onlar Cahanşah padşahı Xorasana getməyə həvəsləndirdilər. Ona görə də türkman hökmdarı Reyə gəlib, ətrafa və məmləkətlərə təvaçılar yollayaraq zəfər nişanlı əsgərlərin toplanması haqqında fərman verdi. O, Əmir Bayəzid Bistama və Məhəmmədi mirzəyə məktub (nişan) göndərdi ki, Reyə qayıtsınlar. Qumda olan divan taxılını qoşuna payladı. Zilhiccə [ayının] (20.10-18.11.1457) ortalarında qoşunların hamısının toplanması bitməmiş sürətli yürüşə başladı.

Beyt

“Səadətə yoldaş olan padşah Reydən,
Tələsdi Cürcan torpağına doğru”.

Simnandakı Barik çayı (Abi-Barik) yolundan keçib Bistamın bir fərsəxliyində cah-calalla dayandı. O aslan yıxan padşah Sənduqşikən yolundan Astarabada yönəldi və Əbülqasim mirzəyə ordugahı mühafizə etməyi tapşırdı. O əsnada zəfər nişanlı qoşunun qaravulları xəbər gətirdilər ki, Mirzə Sultan İbrahim Astarabad cəngəlliyinə daxil olmuş və Baba Həsənlə Mirzə Şahmahmud qeyri-məhdud bir ordu ilə onu qarşılamağa tələsib savaş bayrağını qaldırmışlar. Alinəsəb padşah bu xəbəri eşitdikdən sonra Məhəmmədi mirzəni və Əbülfəth Cagirlünü dəmiri üyüdən bahadırlardan [ibarət] bir dəstə ilə mənqəlay [təyin] edib özü izdihamlı ordu və saysız qoşunla sürətli yürüşə başladı.

Şeir

“Cövşən geyənlərin səfi səhra üzündə,
Dəniz dalğaları arasındakı bir dağa bənzəyirdi.
O igidlər dalğadakı timsahlar kimi idilər,
O süvarilər dağdakı pələnglər kimi idilər”.

---

[1031] Xızırbəy-eli – Türkiyənin indiki Zonquldağ vilayətinin Devrek ilçəsinin köhnə adıdır.
[1032] Bəzi qaynaqlarda bu şəxsin adı Hüseyn kimi yazılır.

Yerin sütunları silahların ağırlığından lərzəyə gəldi və asimanın tavanı atların nallarının cingiltisindən oynamağa başladı.

Beyt

“Qoşunun səfindən titrəmə düşdü dağa və çölə,
Xəncərin qızğınlığından dəniz və quru qaynamağa başladı”.

[Cahanşah] saysız-hesabsız qoşunlarla günəşin doğduğu vaxt şəhərə daxil oldu və hər kəsə hücum çəkdi. Cürcan camaatı heyran və pərişan halda öz evlərində gizləndilər.

Düşmənin hərəkəti haqqında xəbər Baba Həsənə çatdıqda son dərəcə çarəsizliklə fərar vadisinə tələsdi. Mirzə İbrahim də Cahanşah padşahın gəlişini qəbul etməyib şimşək və külək kimi Astarabada yollandı. Yolda ağızdan-ağıza ona belə çatdırdılar ki, təqribən üç min nəfər yaxşı silahlanmış türkman süvarisi Astarabada gəlmişdir. Hərçənd dövlətsevər əmirlər və ordu başçıları səmimiyyət dili ilə “burada bir qədər gözləmək lazımdır ki, ailələrimiz və köçlərimiz bizə qoşulsunlar və Cahanşah barədə də dəqiq bir xəbər alaq” deyə ərz etsələr də, Sultan İbrahim əmirlərin qorxaqlıqdan bu sözləri söylədiklərini güman etdi. O, Əbu-Səid Mirəmi mənqəlay [təyin] edib igidcəsinə yola düşdü. Sonra Cahanşahın yurdçuları[1033] ondan xəbər tutub özlərini şəhərə yetirdilər və xəbəri ərz etdilər. Həmin vaxt Cahanşah padşah hamamda idi. O, Məhəmmədi mirzəni və Əbülfəth bəy Cagirlünü çərxçi[1034] [təyin] etdi. Yolun dar yerində böyük bir savaş baş verdi. Əbu-Səid Mirəm onları qarşısından geri oturdub ordunun mərkəzinə çatdı. Məhəmmədi mirzə, Bayəzid Bistam və b. Bəhram kimi intiqamçı bahadırlar aciz qalıb qaçmağa üz qoydular.

Şeir

“Birisi yola ox tikanını tökdü ki,
Qəzavü-qədərdən kimsə intiqam üçün gəlməsin.
O biri əlindən kəmənd atdı ki,
Arxadan düşmənin ayağını bağlasın”.

Amma ali məqamlı hökmdar Cahanşah padşah öz nəfis vücudu ilə həmləyə keçdi.

Nəzm

“Oynatdı şah ordunun içindən,
Aya və günəşə gedə bilən atını.
O at bulud seli kimi güclü,
Günəşin atı kimi sürətli idi.
Döyüşdə heç bir at onunla yarışa bilməzdi,
O, xəyal atını belə arxada qoyurdu.
[Cahanşahın] əlində şimşək kimi qantökən qılınc vardı,
Onun əcəldən heç bir fərqi yox idi.
Çox sayda başçıları yerə sərmişdi,
Onun qılıncının qarşısında heç kimin qılıncı işə yaramırdı.
Dənizdən qorxusu olmayan bir timsah kimi
Savaş dənizinə daldı şah”.

O, nökərlərinin könlünü alıb dedi:

- Burada bizim ölüm-qalım məsələmiz həll olunur. Ürəyinizi möhkəm tutun ki, bizə iş düşmüşdür.

Sonra qızğın aslan kimi nərə çəkdi, can alan oxun və qan saçan qılıncın yarası ilə düşmənin ciyərini deşdi. Nəhayət, özünü Əbu-Səid Mirəmə yetirib, onu atdan salaraq əllərini bağladı. Mirzə İbrahim qorxudan iki parça olmuş ürəyi ilə qaravula çatdı və düşmənin önündə səf çəkdi. Lakin Cahanşah padşahın nəfis vücudu ilə döyüşə atıldığını eşitməsi bəs etdi ki, qaçmağa üz qoysun. Müzəffər bayraqlı türkman ordusu cağatay ordusunun arxasına keçib onları amansızlıqla qılıncdan keçirdi.

Beyt

“Türkman qoşunu baş kəsməyə başladı,

---

[1033] Padşahın və ya ordunun düşərgə salacağı yeri müəyyənləşdirən və hazırlayan adamlara yurdçu deyirdilər *(Öztürk, şərhlər, s.366)*.

[1034] Çərxçi – hərbi əməliyyatlar zamanı ordunun ön dəstəsi. Çərxçilərin komandanı “çərxçibaşı” adlanırdı.

Zamanın şahı olan Cahanşahın əmri ilə".

Əmir Yusif[1035], Əmir Firuzşahın oğlu Əmir Sultan Hüseyn, Əmir Səadət Xavəndşah və ordu igidlərinin, dərgah böyüklərinin digərləri o vuruşmada qətlə yetirildilər. Cahanşah padşah, Əmir Səid Mirəmə dedi:

- Sən illərlə bahadırlıq iddiası edirsən. Lakin mənim kimi bir bahadırla savaşa belə gəlirsən.

Biçarə cavabında dedi:

- Padşahın dövləti qüvvətli oldu və bəxt bizə yar olmadı. Mirzə İbrahim mənim sözümü qəbul etmədi.

Qəhredici qəhrəman (Cahanşah) onun qətlinə fərman verdi. Qaratəpənin[1036] ətrafı müzəffər məiyyətin gəlişi ilə Gülüstani-İrəmə qısqanclıq bəxş etdikdə, [Cahanşahın] buyruğu ilə məşəl işığında təqribən üç yüz nəfərin boynunu vurdular. Elə həmin gecə türkman ordusu cağatay ordugahına tökülüşüb onların yaraqlarına və övladlarına əl uzatdı.

Ertəsi gün Cahanşah padşah acizlərə və diyarlarından uzaq düşmüşlərə (didərginlərə) qayğı göstərdi və onları Xorasana göndərdi. Ertəsi gün o ali məqamlı padşah yurddan (düşərgədən) hərəkət edib Xərasxanə ətrafında dayandı və orada qışlaq etdi.

Ətrafdan və yan-yörədən Manqışlaq və Cəlair türkmanları, Darülmərz[1037] hakimləri dərgaha gəlib bəndəliklərini və itaətkarlıqlarını izhar etdilər. Məhəmmədi mirzə zəfər bayraqlı ordu ilə Məşhədə və Nişapura getdi. Mirzə Sultan İbrahim tərəfindən elçi gəlib məzmunu tabeçilik izharından ibarət olan bir ərizə gətirdi. Cavab yazdılar ki, qış çıxana qədər o diyarda hakim olsun və baharın əvvəllərində ali mənşəli hökmdarın dərgahına tələssin. Təbəsdə və Tunda olan Əmir Üveys Xavəndşah qasid göndərib sədaqətini izhar etdi. Mirzə Səncər Mərvdən və Maxandan bol peşkəş göndərdi. Sərəxs valisi Abdulla Pirzad dərgaha gəlib hörmətlə qarşılandı.

Mirzə Sultan İbrahim məğlub olduqdan sonra sürətlə hərəkət edən ay kimi gecə-gündüz məsafələri qət edib yekşənbə günü, səfər ayının 7-də (25.12.1457) Herata çatdı. Məlik bazarına daxil olduqda, bir dükanda oturmuş bir qələndər[1038] dedi:

- Padşahım! Ömrün uzun olsun! Əgər bir dəfə də belə bir yürüşə çıxsan, cağatayların kökünü kəsərsən.

Mövlana Əhməd Yasavul və əyan-əşrəflər xeyir-dua və hədiyyə təqdimatı vəzifələrini yerinə yetirdilər. O, Sultan Əbu-Səidin ordusuna müqavimət göstərdiyi üçün böyük bir ehtirama layiq görüləcəyini gözləyirdi. Lakin Mirzə Sultan İbrahim bütün bu [xidmətləri] edilməmiş saydı, hətta divandan onun adına ayrılmış və hələ onun əlinə çatmamış ülufə və ənam vəsaitindən bir məbləğ tələb etdi. Həmin zaman dövlətsevərlərdən biri qalaya gəlib Mövlanaya dedi ki, sizi tutacaqlar. Ona görə də Mövlana müxaliflik etməyə başlayıb qala qapılarını bağladı və asma körpünü yuxarı çəkdi.

Mirzə İbrahim qorxusundan Əhməd Tərxanı onun yanına göndərdi ki, onu [qaladan] bayıra çıxarsın. [Lakin] qəbul etmədi. Ona görə də Mirzə Sultan İbrahim, Şeyx Nurəddin Məhəmməd ibn Şeyx Bəhaəddin Ömər və Şeyx Əhməd Camın övladlarından olan Xoca Məhəmmədi kimi şeyxlərdən ibarət heyəti Sultan Əbu-Səidin yanına göndərdi. Sözünün məğzi o idi ki, "həzrət padşaha münasibətdə tərəfdarlıq və dövlətsevərlik mövqeyindəyəm, ona itaət yolunu tutmuşam, o həzrətin adına və ləqəblərinə sikkə vurdurub xütbə oxudacağam". Həmçinin onunla qohum olmaq istəyini bildirdi.

Sultan Əbu-Səid buyurdu ki, "Mirzə Sultan İbrahim mənim üçün möhtərəm oğlum yerindədir". O, qohumluq təklifini qəbul edib dedi ki, "mənim də istəyim budur ki, onun bacısı ilə evlənim və Heratdan başqa hansı vilayəti istəyirsə, ona bağışlayım". Sonra şeyxlər icazə alıb Herata gəldilər. Onun (Əbu-Səidin) Mirzə Sultan İbrahimə məktubu budur:

"Əlbəttə, Allah ürəklərdə olanı biləndir[1039]. Sultan Əbu-Səid Kürəkan sözümüz[1040]: İzzətli, şanlı, cavanbəxt, kama çatmış, Həzrət Yaradanın himayə etdiyi, əmirlik hədəqəsinin nuru, səltənətin göz bəbəyi, co-

---

[1035] Əmir Seyid Yusif və Əmir Əbu-Səid Mirəm, Əmir Seyid Xocanın oğulları idilər. Əbu-Səid Mirəm həmin şəxsdir ki, öz ağası Mirzə Sultan Məhəmmədə xəyanət edərək Baburun yanına getmiş və Mirzə Sultan Məhəmmədin döyüş planını ifşa edərək onun ölümünə səbəb olmuşdu *(Nəvai, şərhlər, s.568).*

[1036] Qaratəpə (Namazqatəpə) – müasir Türkmənistanın cənubunda, İranla sərhəddədir.

[1037] Darülmərz – Gilan vilayətini bildirir *(V.F.Minorsky. "Tadhkirat al-Muluk", p.170).*

[1038] Qələndər – sərgərdan həyat keçirən sufi, dərviş.

[1039] *Qurani-Kərim, "Ali-İmran" surəsi, 119-cu ayə.*

mərdlik mülkü lütflərinin seçkini, səltənətin və dinin əzizi Sultan İbrahim Bahadır – Allah-taala səadətini və ömrünü uzun etsin – qardaşlığın, dostluğun, məhəbbətin və ittihadın bolluğundan əmin olub bilsin ki, əzmkarlıq və səbat yiyələrinin bağladıqları əhdləri ayların və illərin axışı poza bilməz. Vüqar və vəfa sahiblərinin iman sütunlarını günlərin əli ortadan qaldıra bııməz. "Göylərin və yerin hökmü ancaq Allahın əlindədir"[1041] fərmanı "Allah hər şeyə qadirdir"[1042] tuğrasının şərəfi ilə möhürləndiyi həmin feyzlərə şamil olmuş saatdan bəri və "Qələbə yalnız Allahdandır"[1043] [ayəsinin] qüdrətli hökmü "Əgər siz qələbə istəyirsinizsə, artıq sizə zəfər gəldi"[1044] ünvanı ilə taclandığı, "Allahın sözlərini dəyişə biləcək heç kimsə yoxdur!"[1045] cavahiratının "Doğrudan da, peyğəmbərlərə aid xəbərlərin bəzisi sənə gəlib çatdı"[1046] üzüyünün qaşı üzərinə nəqş edildiyi o lütflərlə dolu zamandan etibarən heç bir yaradılmışın qeyb pərdəsi altına sığınmış və izzət örtüyü ilə örtülmüş məhbubların camalını müşahidə etmək təmənnası qəza hacriblərinin[1047] izni olmadan müyəssər olmaz və heç kəsin əmin-amanlıq zaviyəsində gizlənmişlərin və hörmətin yuxarı başında oturmuşların kamalına yetişmək arzusu qədər (tale) qapıçılarının icazəsi olmadan həyata keçməz. İndi bizim ədalətimizin buludlarının bərəkəti aləmin yaşıllaşmasına səbəb olmuş və bizim mərhəmətimizin buludlarının damlaları cahan xırmanının boy atıb böyüməsinə və şənlənməsinə gətirib çıxarmışdır. "Ədalət dövləti davamlı edər" hökmü ilə asiman kimi uca təməlli qaydalarımızı möhkəmləndirərək onları xələldən uzaq tuturuq və qoruyuruq.

Beyt

"Hadisə daşından asimanın bürcünə nə xələl gələ bilər ki?!
Fəlakət küləyindən ulduzun şamına nə ziyan dəyə bilər ki?!"

Gündən-günə hasil olan "Nemətin davamına şükür" məzmununa tam inanmaqla o bəxşişin bərəkəti və lütfün uğurları ilə dövlətin və bəxtiyarlığın üzü, əzəmət va səadətin çöhrəsi daha parlaq və daha dayanıqlı olur. Çünki cahandarlıq meracına yüksəlmə və hökmranlıq mərtəbələrinə qalxma istedadı o dövlət adamına nəsib olur ki, o, doğruluq və saflıq zinəti ilə bəzənmiş, yalan və riya ləkəsindən arınmış olsun. Fitrət dənizinin cəvahirləri və qüdrət gülşəninin çiçəkləri olan dünya sakinləri "Sultan Allahın kölgəsidir" [kəlamına] uyğun olaraq, onun ümumi mərhəməti sayəsində şiddət günəşindən və onun dərin comərdliyi payəsində hadisələrin sərsər küləyindən pənah və sığınacaq tapa bilsinlər. Hal-hazırda o möhtərəm və ulu qardaş tərəfindən "İbrahim Kəbənin təməllərini yüksəltdi"[1048] [ayəsinin] doğru xəbərində olduğu kimi yekdillik qəsrinin yüksəldilməsi haqqında mötəbər xəbərlər verən, könül aynalarında sədaqət nəqşindən və həqiqət surətindən başqa bir şeyin olmadığı xeyirxahlıq sahiblərinin dilindən bizim ali qulağımıza çatmışdır və "Həqiqətən, İbrahim Allaha müti, batildən haqqa tapınan bir imam (rəhbər) idi"[1049] [ayəsinin] şahidliyi əsasında tamamilə qəbul edilmişdir. Sabiq əməllər və ardıcıl fəaliyyətlər bu mövzuya dair işarətlər və dəlillərdir. Həqiqəti təlqin edən ilham Allah-taalanın yardımı ilə "Biz daha öncə İbrahimə də öz doğru yolunu nəsib etmişdik"[1050] məzmununun hasili mükəmməl bir halda vəsfləndi. "Zəkəriyya da bir zamanlar "Ey Rəbbim! Məni tək (kimsəsiz, varissiz) buraxma" deyə nida etmişdi"[1051] sualı "Biz (Zəkəriyyanın) duasını qəbul buyurduq, ona Yəhyanı bəxş etdik"[1052] cavabı ilə şərəfləndi və qohumluq mərtəbəsinə layiq görüldü. Qardaşlıq dərəcəsindən övladlıq və oğulluğa tərəqqi etdi. "Sənin arxanı qardaşınla möhkəmləndirəcəyik"[1053] vədi həyata keçdi. Diləkləri yerinə yetirən və işlərə əncam çəkən feyzli iradə onu qəbulla qarşıladı və səltənət dili o əziz övladın iqbalının tələbi ilə sevinc içində xüsusi minbər üzərində "Siz yaxınlaşdıqca, gözüm də sizə yaxınlaşır" xütbəsini oxudu.

---

[1040] O dövrün hökmdar fərmanlarının və məktublarının başlanğıcında bir qayda olaraq, "sözümüz" ifadəsi türkcə yazılırdı və "Əhsənüt-təvarix"in mətnində də bu qaydaya riayət edilmişdir.

[1041] *Qurani-Kərim, "Casiyə" surəsi, 27-ci ayə.*

[1042] *Qurani-Kərim, "Ali-İmran" surəsi, 29-cu ayə.*

[1043] *Qurani-Kərim, "Ənfal" surəsi, 10-cu ayə.*

[1044] *Qurani-Kərim, "Ənfal" surəsi, 19-cu ayə.*

[1045] *Qurani-Kərim, "Ənam" surəsi, 34-cü ayə.*

[1046] Həmin ayə.

[1047] Hacib – mənası "qapıçı" deməkdir. Müqəddəs ziyarətgahların nəzarətçiləri və qoruyucuları da "hacib" adlanırdılar. Burada məcazi mənada işlənmişdir.

[1048] *Qurani-Kərim, "Bəqərə" surəsi, 122-ci ayə.*

[1049] *Qurani-Kərim, "Nəhl" surəsi, 120-ci ayə.*

[1050] *Qurani-Kərim, "Ənbiya" surəsi, 51-ci ayə.*

[1051] *Qurani-Kərim, "Ənbiya" surəsi, 89-cu ayə.*

[1052] *Qurani-Kərim, "Ənbiya" surəsi, 90-cı ayə.*

[1053] *Qurani-Kərim, "Qəsəs" surəsi, 35-ci ayə.*

“İşlər zamanların girovudur” hökmü ilə indiyə qədər bağlı olan sədaqət qapısı o dövlətyarın doğru iradəsinin və gözəl əqidəsinin açarları ilə açıldı. O, imtinanı, səhlənkarlığı, çəkinməni və inadkarlığı ağıl məzhəbində və dövlət şəriətində qadağan saydı. Allah-taalaya həmd olsun ki, o səadətli övlad gənclik hisslərinə baxmayaraq, qardaşlar arasında bu yardımlaşmaya və bu anlaşmaya qol qoydu. Təzim edilməsi vacib olan Kərimin (Allahın) kərəmindən gözlənən odur ki, İlahi himayə onu bürümüş alovları “Ey atəş! İbrahimə qarşı sərin və xətərsiz ol!”[1054] xitabı ilə öz ismətinin pənahında hifz etsin.

Bu gün öz qeyrət öhdəliyim və dövlət təminatım ilə onunla aramdakı [anlaşma] qaydalarını möhkəmləndirməyi, yardımlaşma, uzlaşma və dostlaşma mərasimini qüvvətləndirməyi vacib və lazım bilərək, inkarçı firqənin və həsədçi zümrənin tərəddüdünü dəf etmək, şər adamların vəsvəsələrini ortadan qaldırmaq və xeyirxahları xatircəm etmək üçün böyük şeyxlərin və ulu mövlaların hüzurunda “Əhd etdiyiniz zaman Allaha verdiyiniz əhdi yerinə yetirin”[1055] əmrini yerinə yetirmək zərurətinin nəqşini sarsılmaz və korlanmaz səbat və davamlılıq qələmi ilə nurlu qəlbin lövhəsinə yazıb çeşidli andlar və vədlərlə onu təsdiq edirəm. Bu sayaq ki, ömrüm boyunca o əziz qardaşla, yəni dövlətin və dinin əzizi Sultan İbrahim Bahadırla – Allah-taala onun ömrünü uzatsın – məhəbbət və sevgi məqamında olacağıma, ona xəyanət etməyəcəyimə, onun haqqında pislik düşünməyəcəyimə, onu edam və yox etməyə çalışmayacağıma, onun cah-calalının, izzətinin və iqbalının yüksəlməsi istiqamətində gözəl səylər göstərəcəyimə dair Tanrıya, peyğəmbərlərə, Mustafaya (Məhəmməd peyğəmbərə), övliyalara əhd edirəm, Ulu, Əzəmətli və Kərim olan Allaha and içirəm. Əgər bir kəs onun haqqında bir məkr düşünsə və ondan agah olsam, o əziz qardaş dövlət mehvərinin mərkəzi kimi ayağını dostluq dairəsindən və əhd-peyman yolundan kənara qoymayacağı, o yöndə sabitqədəm olacağı, bizə itaət və tabeçiliyin doğru yolundan çıxmayacağı və yanlış yola sapmayacağı təqdirdə...[1056] O, ömrünün erkən çağına və yaşının azlığına baxmayaraq qətiyyətli və qərarlı olacaqsa, dostluğun gözəlliyinə, xilaf və nifaq aqibətinin zərərinə vaqif olan zati-alilərimiz axı necə səmimiyyət və sülhün geniş yolundan darlıq və münaqişə tərəfinə sapa bilər?! Bu, bizim sizinlə bağladığımız bir əhd-peymandır və bu əhdin yerinə yetirilməsi öhdəçiliyi hər iki cahanda sizin üzərinizdədir. 862-ci ilin cəmadiyüləvvəl ayının on səkkizinci günündə (03.04.1458) yazılmışdır”.

Bu ilin əvvəllərində (1458-ci ilin baharında) Xorasan vilayətində hökmü keçən bir neçə padşah vardı: Cahanşah padşah Astarabaddan Səbzəvara qədər hakim idi; Sultan Əbu-Səid padşah Məvəraünnəhrdə, Türküstanda və Bəlxdə oturmuşdu; Mirzə Əlaüddövlə Dəşti-Qıpçaqdan gəlib Heratın kənarında[1057] yerləşmişdi; Mirzə Sultan İbrahim Heratda; Mirzə Səncər Mərvdə; Mirzə Şahmahmud Tusda; Mirzə İsgəndər Türkmanın oğlu Qasım, Əmir Xəlillə ittifaq halında Sistanda; Əhməd Yasavul İxtiyarəddin qalasında; Birkə Moğol Nərətu qalasında; Abdulla Pirzad Sərəxs qalasında; Əmir Baba Həsən İmad qalasında; Əmir Xavəndşahın [oğlu] Əmir Üveys Təbəs qalasında; Əmir Məhəmməd Xudadad Səəluk qalasında[1058] və Əmir Həsən Şeyx Temur Xəbuşan qalasında idi.

### Mirzə Əlaüddövlənin Herata gəlməsi və Xorasan və Herat diyarında baş vermiş bəzi hadisələr haqqında

Mirzə Əlaüddövlə, Mirzə Baburdan qaçdıqdan sonra bir neçə il Moğolustan ətrafında qaldı. Mirzə Baburun ölüm xəbərini eşitdikdə isə Xarəzmdən Əbivərdə gəlib Mirzə Sultan İbrahimin yanına qasidlər göndərdi. Şahzadə ona məhəbbətamiz sözlərlə ismarış yollayıb onu qarşılamağa tələsdi. Sincab çayı kənarında iki səadət ulduzunun qovuşması baş verdi. Məşvərətdən sonra belə qərara alındı ki, Mirzə Sultan İbrahim qoşunlarla Təxti-mülkdə[1059] qalsın və Mirzə Əlaüddövlə Herata gedib bir neçə gün istirahət etsin.

[1054] *Qurani-Kərim, “Ənbiya” surəsi, 69-cu ayə.*
[1055] *Qurani-Kərim, “Nəhl” surəsi, 91-ci ayə.*
[1056] Cümlə natamamdır.
[1057] “Mətləüs-səədeyn”ə görə, Əbivərd vilayəti ətrafında *(Nəvai, şərhlər, s.574).*
[1058] Səəluk – Quçan vilayətində, qədim Tus şəhərindən 3 fərsəx şimal-şərqdə *(Nəvai, şərhlər, s.574).*
[1059] Təxti-mülk – Badğis yaxınlığında *(Nəvai, şərhlər, s.574).*

Sonra o cənab cümə günü, cəmadiyülaxır ayının 10-da (25.04.1458)[1060] Herata gəldi. O, Sağ-Süleyman kəndindən təntənə ilə şəhərə daxil olub, Gövhərşad bəyim mədrəsəsində dayanaraq oranı ziyarət etdi və Zağan bağına yollandı. O əsnada Əhməd Yasavul xahiş etdi ki, qalaya gəlsin. Mirzə Əlaüddövlə qalaya getdi. Eyş-işrət büsatı quruldu. Rəiyyətin üzərinə adambaşı vergi qoyuldu. Hələ o vergi toplanmamış Sultan İbrahimin yanından qasid gəlib ərz etdi ki, türkman qoşunları yaxınlaşmışlar. Hadisənin şərhi Mirzə Əlaüddövləyə çatdıqda, bol kədərlə şaban [ayının] başlanğıcında (14.06.1458) Qur və Qərcistan[1061] diyarına yola düşdü.

Mirzə Əlaüddövlənin fərar etməsindən sonra seyidlər, mövlalar, zəiflər, güclülər, şəriflər, alçaqlar, ortabab adamlar və sənətkarlar türkman ordusunun qorxusundan sərsəm oldular və titrəməyə başladılar. Oğrular və əclaflar o dərəcədə əl-qol açdılar ki, onun şərhini söyləmək və yazmaqla izah etmək mümkün deyil.

Baharın əvvəllərində ali mənşəli hökmdar (Qaraqoyunlu Cahanşah) qışlaq yurdundan köç etdi. Məşhəd ətrafına çatdıqda Məhəmmədi mirzə atasının ordugahına gəldi. Mənzilləri və mərhələləri sürətlə keçib Heratın on beç fərsəxliyinə yetişdi. Mirzə Sultan İbrahim əmirlər, dövlət ərkanı, məmləkətin böyükləri və əyanları ilə Qur və Qərcistan tərəfə getdi. Onlarla birlikdə şəhərdən və vilayətdən iki min[1062] ailə yola düşdü. Şabanın (12.08-09.09.1458) axırlarında[1063] Pirzad bəy Buxari Herata daruğa göndərildi.

O diyarın havası fələk iqtidarlı məiyyətin tozanağından müşk ətri saçdıqda, Şeyx Nurəddin Kazeruni, Seyid Əsiləddin Vaiz, Mövlana Şeyx Həsən kimi şəhər böyükləri və rəiyyət [onları] qarşılamağa tələsib, tabeçilik və bəndəlik kəməri bağlayaraq yeri öpmək mərasimini yerinə yetirdilər. Bu səbəbdən o həzrətin (Cahanşahın) hüsn-rəğbət günəşi mərhəmət bürcünün zirvəsindən əmin-amanlıq şəfəqini o diyarın əhalisi üzərinə saldı. Mövlana Cəlaləddin Qaininin oğlu Mövlana Əbdülcabbarı qazılıq və möhtəsiblik mənsəbinə təyin etdilər. Bukavullar qucaqlarına "Quran" kitabları alıb böyük əmirlərə və sərdarlara yüksək andlar verdilər ki, öz nökərlərinə nəzarət edərək onların özbaşınalıq törətməsinə və camaata əziyyət etməsinə imkan verməsinlər. Elə həmin gün camaatın tarlalarına girmiş çoxlu dəvə, qoyun və inək müsadirə edildi və onların sahibləri cəzalandırıldı. Ədalətin avazı yayıldı. Qısa zamanda vətənini tərk etmiş hər kəs öz yerinə qayıtdı. Fərman verildi ki, Şahrux padşahın türkcə və farsca buyruqları və hökmləri mötəbər sayılsın və əvvəlki qaydada imzalansın. Seyid Nizaməddin Aşuru və Mövlana Məhəmməd Qainini vəzirliyə təyin etdilər.

Mülkün şəriki (şərikül-mülk) və divan əmiri (əmiri-divan) olan Əmir Bayəzid Cagirlü Xorasan əhlinin könlünü almaqla məşğul oldu və Əhməd Yasavulun yanına söz bilən elçilər göndərib onu çağırdı. Əhməd Yasavul pərişanedici sözlərlə ismarış göndərib savaş və döyüş əlamətlərini nümayiş etdirdi. Ona görə də izdihamlı əsgərlər qalanı bir mərkəz kimi əhatəyə aldılar. Kama çatmış əmirlər qala ətrafında bir hasar düzəltdilər və onu on gəz yüksəldərək oraya oxçular yerləşdirdilər. Hər dəlikdə möhkəm kamana malik on cavan təyin etdilər. Əhməd Yasavulun tabeçilikdən başqa dərmanı olmadığı üçün son dərəcə çarəsizlik üzündən uzlaşma yolunu seçdi. O, elçilər göndərib aman istədi. Türkman hökmdarı onun xahişini qəbul etdi. Ona görə də Əhməd Yasavul Heratdan çıxıb [Cahanşahın] feyz bəxş edən barmaqlarını [öpmək üçün] əyilmək iftixarına və şərəfinə nail oldu. O, padşahanə hüsn-rəğbət və xosrovanə lütfkarlıq qazanaraq tay-tuşlarından üstün və müstəsna oldu. İxtiyarəddin qalasının hakimliyi Əmir Bayəzid Bistama verildi. Ali məqamlı padşah altı ay Heratda oturduqdan sonra hərəkət bayrağını Heratrud vilayətinə doğru qaldırdı və Şahrux padşahın mənzili olan Ləkləkxana[1064] mövqeyində dayandı. Həmin zaman Mirzə Səncərin elçiləri Mərv və Maxan tərəfdən, Əmir Xəlilullanın elçisi isə Şirvandan asiman nişanlı dərgaha gəldilər. [Cahanşahın] oğlu Əbu-Yusif mirzə Kirmandan cövşən geymiş qoşunla [gəlib] atasının ordusuna qoşuldu. Cahanşah padşah Ləkləkxana mövqeyindən Kəhdəstan[1065] tərəfə döndü.

Bu əhvalatın cərəyan etdiyi vaxt cah-calallı [hökmdarın] qulağına çatdı ki, zəfər nişanlı türkman ordusundan üz çevirmiş Əlaüddövlə və onun oğlu Mirzə Sultan İbrahim Qur vilayətindədirlər: Mirzə Əlaüd-

[1060] "Mətləüs-səədeyn"də bu hadisə 7 cəmadiyülaxır (22 aprel), cümə gününə aid edilmişdir *(Nəvai, şərhlər, s.575).* 1458-ci ilin 22 apreli şənbə gününə, 25 apreli isə çərşənbə axşamı gününə təsadüf edir.

[1061] Qur (Quristan) – Əfqanıstanın mərkəzi hissəsində, Hərirud çayı boyunda yerləşən, əsasən qur tayfası ilə məskunlaşmış tarixi mahal. Qərcistan – indiki Əfqanıstanda, Mürğab çayının yuxarı axarlarında, Heratla Meymənə arasında yerləşən tarixi mahal.

[1062] Paris nüsxəsi: "min"; "Kitabi-Diyarbəkriyyə": "on min" *(Nəvai, şərhlər, s.575).*

[1063] "Kitabi-Diyarbəkriyyə"yə görə: "ortalarında"; "Həbibüs-siyər"ə görə: "15-də" *(Nəvai, şərhlər, s.575).*

[1064] Ləkləkxana – Heratdan 6 fərsəx aralıda, Kəmiran bölgəsində, Herat çayının cənubunda *(Nəvai, şərhlər, s.577).*

[1065] Kəhdəstan – Heratın şərqində bir çəmənlik *(Seddon, şərhlər, s.235; Nəvai, şərhlər, s.580).*

dövlə Aşağı Qurda, Mirzə Sultan İbrahim isə Yuxarı Qurdadır. Mirzə Əlaüddövlənin Əmir Xəlilə tam etimadı vardı. Onun oğlu Məhəmməd Xəlil, Mirzə Sultan İbrahim tərəfindən qaravul olan Qara Bahadıra gecə basqını edib, onun bütün mallarını qarət atəşi ilə küləyə verdi. Qara Bahadır təkbaşına ata minib Mirzə Sultan İbrahimin yanına getdi. Mirzə Sultan İbrahim atasının hüzuruna şikayət göndərdi. Mirzə Əlaüddövlə xəbər verdi ki, "Qara Bahadır mənim qulamımdır və mən ondan azuqə gözləyirdim; ona görə də belə bir hadisə üz verdi".

Beləliklə, bu məsələ ata ilə oğulun bir-birinə can düşməni olmasına səbəb oldu. Hər iki tərəf qoşun tərtib edib savaş ahəngi ilə irəli gəldilər və aralarındakı məsafə bir köç mənzilinə çatdı.

Beyt

"Ey ürək, axtarma zəmanə insanlarında vəfa gözü,
Çünki bu yoldaşların xilqətində mürüvvət yoxdur".

Tərxanlılar vəfasızlıq yolunu və şivəsini seçdi, onların hamısı Mirzə Əlaüddövlənin tərəfinə keçdi. Mirzə Sultan İbrahim tam əlacsız qalaraq yeganə ümid kimi böyük mənsəbli atasına doğru üz tutdu. O, oğlunu həbs etdi. Şahzadənin mülazimi olan bəzi tərxanlı əmirləri Əmir Xəlilin davranışına dözə bilməyib müxaliflik etməyə başladılar.

Bu əsnada şahzadənin hökmü ilə Mirzə Əbu-Səidin yanına getmiş Əmir Abdulla Xoca Tərxan qayıtdı. O, şahzadənin həbs olunduğunu gördükdə bu vəziyyətə tab gətirmədi. Tərxan [qəbiləsindən] və digərlərindən [ibarət] çoxsaylı bir dəstə onunla ittifaq bağlayıb borğu (şeypur) çaldılar və elə ilk həmlədə şahzadəni həbsdən qurtarıb, onu ata mindirərək Saxur[1066] və Tulək[1067] vilayətinə hərəkət etdilər. Yenidən şahlıq tacı İlahi qayğının uğuru sayəsində onun göyə ucalan başına qoyuldu və bəxt taxtı onun yüksək məqamlı dövləti ilə şərəfləndi. Təbil, bayraq, məiyyət və qoşun intizama salındı.

Cahanşah bu haldan agah olduqda, başqa bir xəbər də ardıcıl surətdə gəlib çatdı ki, Sultan Əbu-Səid Bəlxdən çıxıb köç edə-edə gəlməkdədir. O əsnada Mövlana Nəcməddin Ömər, Sultan Əbu-Səidin yanından elçi kimi gəlib çatdı. Fərraşlar[1068] türkman hökmdarının əmri ilə son dərəcə əzəmətli bir bargah ucaldıb kölgəliklər və alaçıqlar qurdular.

Nəzm

"Günəş kimi iki yüz zərəfşan kölgəliyi (sayəbanı),
Bir-birinin üzərinə çəkdilər asiman kimi.
Günəşin şüa xətlərinə bənzər şəkildə,
Saray pərdələrinin kəndirləri göyə ucaldı.
Yetərincə (çoxlu) çadır Sürəyyaya baş qaldırdı,
Min asiman yerdə peyda oldu".

Cahanşah padşah qurban bayramı günündə tam əzəmətlə səltənət taxtında məqam və aram tutdu. Bargah müqərrəbləri və dərgah əmirləri münasib yerlərdə oturdular. Məclisin önündə bir dəstə hacib ay kimi üzlərinə gümüşü rəngli pərdə çəkmiş halda gözlərini və qulaqlarını gələcək göstərişlərə dikmişdilər.

Şeir

"Pəri peykərlilər ədəb üzündən,
Söhbətdən bağladılar ağızlarını qönçə kimi.
Sənubər kimi qədd-qamətlilər hər tərəfdə cilvə etdilər,
Hamısının telindən fitnə baş qaldırırdı".

O əsnada Mirzə Əlaüddövlə Qərcistandan türkman hökmdarının dərgahına gəlib münasib bir yerdə qərar tutdu. Sultan Əbu-Səidin elçiləri olan Mövlana Nəcməddin Ömər və Mövlana Yusif Əttar dərgaha daxil oldular. Cahanşah padşah ali mənşəli padşahların və iqtidarlı hökmdarıların üsulu ilə söhbət edib məhəbbətamiz kəlmələrin və sevgi dolu sözlərin sığalı ilə onların könül aynasından kədər pasını sildi. Sözügedən

[1066] Saxur – Əfqanıstanın Qur vilayətindədir *(Nəvai, şərhlər, s.578).*
[1067] Tulək – Əfqanıstanın Qur vilayətinin cənub-qərbində bir bölgədir.
[1068] Fərraş – hökmdarın yataq və xalılarını döşəyən, çadırlarını quran məmur. Həmçinin məscid, mədrəsə kimi vəqf əsərlərinin təmizlik işləri ilə məşğul olan xidmətçilər də fərraş adlanırdılar *(T.Yazıcı, M.İpsirli. Ferraş // TDVİA, cilt: 12, yıl: 1995, s.408-409).*

ayın[1069] 19-da (28.10.1458) uğurlu və qalibiyyətli padşah (Cahanşah) öz vəziri Əmir Nizaməddin Seyid Aşuru elçilərlə birlikdə sultanın (Əbu-Səidin) dərgahına göndərdi.

Onlar aləmin pənahı olan dərgaha gəldikdə belə ərz etdilər:

- Məmləkətinin genişliyi Şam və Rum nahiyələrindən bu sərhədə və ölkəyə qədər uzanan Cahanşah padşah güclü və adlı-sanlı bir hökmdardır. Düşmənləri ondan qorxurlar. Onun gözündə qoşunun azlığı və çoxluğu fərq etmir.

Nəzm

"Əgər onun qəhri yer üzünə kölgə salsa,
O cahanda həyat ortaya çıxar.
Ölüm daim onun cəzasından,
Sümüklərində qızdırma və titrəmə hiss edər".

İndi o, bu diyara gəlmiş və bəxt taxtında aram tutmuşdur. Elə bu zaman sizin elçiləriniz gəldilər və sülhdən söz saldılar. O həzrət də bəndəni (məni) göndərdi ki, sizinlə şifahi danışım, məsələni aydınlaşdırım və məhəbbət qaydalarını möhkəmləndirim.

Sultan Əbu-Səid də xoşagələn sözlər və bəyənilən kəlmələr dedi və etibarlı bir adamını Seyid Aşurla birlikdə Cahanşah padşahın dərgahına göndərdi.

O zaman Əhməd Tərxanla bahadırlar Mirzə Sultan İbrahimdən üz döndərib Cahanşah padşahın yanına gəldilər və dedilər:

- Yaxşısı budur ki, Heratda qışlaq etsinlər.

Sözügedən ayın axırlarında (1458-ci ilin noyabr ayının əvvəllərində) Seyid Aşur, Sultan Əbu-Səidin elçiləri ilə birlikdə gəlib çatdı və layiqli sözlər ərz etdilər. [Cahanşahın] şərəfli könlü onunla təmkin və qərar tapdı. Sultan Əbu-Səidin gəlməsi [haqqında] söz-söhbət ortadan qalxdı və təqribən iyirmi gün kimsə bilmədi ki, o, hansı səmtə getmişdir. Bəlkə, o, məkr və hiylə üzündən dərə-təpə yolu ilə məxfi şəkildə irəliləməkdə idi? Vəziyyətin nə yerdə olduğu məlum olmadığı üçün Cahanşah padşah Ləkləkxanadan köç edib Kəhdəstan yolu ilə getdi ki, əgər həmin yoldan gəlsə, onu dəf etməklə məşğul olsun.

İyirmi gündən sonra Evbeh yolundan onun qoşununun ön dəstəsi sabit və səyyar göy cisimləri kimi doğmağa başladı. Mərrix ovlayan, aslan yıxan, qılınc vuran ay üzlü türklər çərxi-fələk kimi kəcrəftar olan arabalarla və təqribən beş min[1070] süvari ilə dağdan endilər. Rəngarəng və cürbəcür bayraqların əksindən və parıltısından o yerin zəmini gülzara və laləzara döndü.

Beyt

"Qoşun bayraqlarından zəmin Kisranın qübbəsi kimi,
Əlvan bayraqlardan hava şanlı bir namə kimi".

Şeir

"Tələsdi iki şah iki tərəfdən amansızlıqla,
Lakin hər ikisi coşdu savaş həyəcanı ilə.
Belə ki, zəmin aralıqda daraldı,
İki qoşunun arasında iki fərsəx [məsafə] qaldı".

Cahanşah padşahın ordusuna xəbər çatdı ki, Sultan Əbu-Səid mirzə elçilərin ardınca yola çıxmışdır. O, bu işin qəribəliyinə mat qaldı. Çünki sülh və barışıq izhar etdikdən sonra belə bir hazırlıqlı qoşunun üzərinə gəlməyə cürət etmək qəribə işlərdən idi.

Cahanşah padşah xəyal aynasında döyüş surətini və işin üzünü qaranlıq gördü və gen dünya onun cahanı görən gözündə "mim" [hərfinin] halqasından daha dar göründü. Amma hiddətdən atəş kimi püskürdü və küləkdən coşan dəniz kimi kükrədi. Fələyin qütbü kimi tez gedən, döyüş meydanında sərgərdan fələyin mehvər xətti kimi möhkəm dayanan, ildırım və şimşək kimi ox və nizə atan, günəş və ay kimi cövşən geymiş və qalxan qurşanmış, günəş kimi qılınc vuran və Bəhram kimi xəncər oynadan bir qoşunla Herat tərəfə qayıtdı.

---

[1069] Zilhiccə ayı nəzərdə tutulur (bax: *Kəmaləddin Əbdürrəzzaq Səmərqəndi. Mətləüs-səadeyn və məcməül-bəhreyn. Ba ehtemami: Ə.Nəvai. Tehran, 1383, IV c., s.839*).

[1070] "Əhsənüt-təvarix"in nüsxələrində 50 min yazılsa da, Ə.Nəvai "Kitabi-Diyarbəkriyyə"yə əsasən, mətnə düzəliş edərək 5 min yazmışdır *(Nəvai, şərhlər, s.580).*

Bu vaxt Mirzə Pirbudaq on səkkiz min nəfər yaxşı silahlanmış süvari ilə Quhistan yolundan tam sürətlə gəlib çatdı. Əsgərlər ürəkləndilər. Onun gəlməyinin səbəbi bu idi ki, Xorasanın və Şahrux sultanın taxtının və məmləkətinin fəthi xəbəri Farsda yayıldıqda bir-birinin ardınca xəbər çatdı ki, Xorasanın ətrafında və yan-yörəsində bir sıra düşmənlər qızğın aslanın pəncəsindən qaçan vəhşi ceyranlar kimi heyran və sərgərdan qalsalar da, fürsət gözləyirlər ki, əgər macal tapsalar, hücuma keçsinlər. Buna görə də Mirzə Pirbudaq Fars və İraqdan Xorasana yollanıb, atasının ordusuna qoşularaq mənqəlay şəklində yola çıxdı. O tərəfdən də bir dəstə bahadırlar ox və kamana əl atdılar. Mirzə Pirbudaq onlardan üz çevirdi. Onun bir sıra mülazimləri əsir düşdülər. Sonra yenə də atasına ərz etdi ki, "mənə izin ver, özümü Sultan Əbu-Səidə yetirim və onların bayıra çıxmalarından və qoşun toplamalarından öncə onu pərişan edim". Sonra atasının ordusundan ayrılıb təqribən bir fərsəx irəli getdi. Cahanşah, Əbülfəth bəy Cagirlünü göndərdi və onu həmin yanlış hərəkətdən daşındırdı. Çünki aqibəti qeyb pərdəsi arxasında gizlənmiş müharibəyə və savaşa ümid bəsləmək olmazdı. Həmçinin Həsənəli[1071] qiyam qaldırmış və Azərbaycanı ələ keçirmişdi. [Cahanşah dedi]:

- Bizim Xorasanda qalmağımız və xanimanı onun əlində qoymağımız məsləhət deyildir. Sultan Əbu-Səidlə savaşmaq məqsədəuyğun deyil. Qələbə ya onun olacaq, ya bizim. Biz qalib gəlsək belə, Xorasanı [əlimizdə] saxlaya bilməyəcəyik. Düşməni arxamızda qoyub İraqa və Azərbaycana üz tutmağımız doğru olmaz. Əgər o qalib gəlsə, onda nə edəcəyik? Rüsvayçılığa və bədnamlığa məruz qalmaq, öz evimizi qürur atəşi ilə yandırmaq ağlasığmaz bir iş olardı.

Əbülfəth bəy bu xəbəri çatdırdıqdan sonra [Pirbudaq] qayıtdı və iki tərəf arasında sülh təşəbbüsləri başladı. Cahanşah padşah tərəfindən Qazı Abdulla gedib-gəldi. Adı çəkilən şəxs əmirlərin vasitəçiliyi ilə əlahəzrətin (Əbu-Səidin) ayağını öpmək (ona təzim etmək) şərəfinə nail oldu, sülh və səfa haqqında sözlər ərz etdi. Sultan Əbu-Səid buyurdu:

- İki tərəf arasında sülh qaydaları o vaxt möhkəmlənər ki, Cahanşah padşah Azərbaycan hakimiyyəti ilə kifayətlənərək Xorasan məmləkətindən əl çəksin[1072].

Bu barədə çoxlu söhbət oldu. Axırda belə razılığa gəldilər ki, türkman hökmdarı Xorasan diyarını ta Simnan sərhədinə qədər sultan həzrətlərinə (Əbu-Səidə) versin və Astarabad şəhərini Mirzə Əlaüddövləyə bağışlasın. Sülhnamənin surətini Qazı Əbu-Bəkr Tehrani qələmə aldı. Cahanşah padşah Yəhyabad[1073] məkanından köç edib Azərbaycana yola düşdü.

Sultan Əbu-Səidin əmirləri Seyid Əsiləddin Ərğun, Əmir Mübarizəddin Pəhləvan Hüseyn Divanə və Qazı Qütbəddin Əhməd Herəvi şəhərə daxil oldular. O zaman Cahanşah padşahın oğlu Əbu-Yusif mirzə cümə məscidində namaz qılıb eşiyə çıxdı və ərk qalasının ətəyində əmirlərlə görüşdü. Əmirlər salam verdilər. Əbu-Yusif mirzə keçdi. O iki qoşun bir-biri ilə qarışdı və əsla bir-birinə hücum etmədilər. Amma Heratın əclafları və yetimləri (quldurları) türkman əsgərlərindən bəzilərini soydular. Sultan Əbu-Səid şəhərə daxil olub yetimləri (quldurları) cəzalandırdı və türkmanlara hörmət göstərdi.

Cahanşah padşah hər gün on fərsəx yol qət edirdi. Əsgərlər dəstə-dəstə olub, sağdan və soldan iki-üç günlük yol gedərək vilayətləri qarət edirdilər, əsir və qənimət gətirirdilər.

Nişapura çatdıqda Pirbudaq mirzə Şiraza [getmək] əzmi ilə ordudan ayrıldı və Əbu-Yusif mirzə Kirmana [getdi]. O oğullardan hər biri qarət edə-edə gedirdilər. Pirbudaq mirzə Yəzdə çatdıqda, üsyana və tüğyana başladı. O, şəhərin və vilayətin üzərinə mal (vergi), peşkəş və savəri qoydu, İsfahan vilayətinin bəzi yerlərinə - Ruydəştə, Nətənzə və Ərdistana daruğa, mühəssil və baratdar[1074] göndərdi, əyan-əşrəfləri tələb etdi, yüz tümən Nətənzin üzərinə və yüz tümən də Ərdistanın üzərinə [vergi] qoydu. Əbərquha[1075] çatdıqda da eyni cür rəftar etdi.

Cahanşah padşah, Həsənəlinin üstünlük qazanmasından qorxduğu üçün Pirbudaq bilirdi ki, atasının Azərbaycandan uzaqlaşmağa macalı yoxdur və bu üzdən də tabeçilik yolundan çıxdı. Pozğun xəyallar onun

---

[1071] Cahanşahın oğlu.
[1072] Nuruosmaniyyə nüsxəsi: "Xorasan və İraq məmləkətindən tamamilə əl çəksin".
[1073] Yahyabad (Yahya-abad) – Herat yaxınlığındadır *(Nəvai, şərhlər, s.583).*
[1074] Mühəssil və baratdar – vergiyığanlar nəzərdə tutulur.
[1075] Əbərquh – İranın Fars vilayətində güclü istehkamlara malik olan və İstəxr – Yəzd yolunun təxminən tən ortasında yerləşən şəhər.

beyin şəhristanını qarışdırdı. Batil həvəs dalğaları onun doğru düşüncəsinin şamını və çırağını söndürüb onun eyş və hüzur mənbəyinin gözünə fitnə-fəsad çör-çöpü saldı.

Cahanşah padşah Simnana çatdıqda, Damğan daruğası şəhəri tərk edib özünü ordugaha yetirdi. Ardıcıl köç etmək və yer dəyişdirmək ucbatından təqribən iyirmi min dəvə, on min at və qatır tələf oldu. Hər mənzil başında qablardan, xalçalardan, çadırlardan və alaçıqlardan ibarət yükləri və malları hədsiz-hesabsız şəkildə atıb gedirdilər. Hər iki addımdan bir bir dəvə, at və ya qatır yıxılıb qalırdı. Bir fərsəx məsafədə Qazı Əbu-Bəkr Tehrani yol üstündə [yıxılıb qalmış heyvanların] sayının üç yüzdən çox olduğunu hesablamışdı.

Bu əhvalatın əvvəllərində Həsən padşah çoxlu ordu ilə hərəkət bayrağını Gürcüstan tərəfə qaldırdı və Amid şəhərində əsir saxladığı Əlişəkər bəyin oğlu Pirəli bəyi azad edib Cahanşah padşahın yanına göndərdi. Xeyirxah hökmdar (Həsən padşah) Fərat çayından keçib Tarmuq yaylağında[1076] cah-calalla dayandı. Ali məqamlı padşah ordunun toplanması üçün bir müddət gözlədi. O məkanda da Savalan bəyi azad edib Cahanşah padşahın yanına yolladı. İzdihamlı qoşunlar Məxaç qalasını[1077] bir mərkəz kimi dövrəyə aldılar. Bir neçə gün sonra aləmi yandıran ordu zor və güc yolu ilə o qalanı çoxlu mallarla birlikdə ələ keçirib Ərzuruma döndü. [Həsən padşah] Sultan Xəlili, Xəlil Təvaçını, Söhrab bəyi və Əmir bəy Mosullunu bir dəstə Ağqoyunlu bahadırları ilə Kəmax qalasına göndərdi, özü isə izdihamlı əsgərlərlə Qarahisara yollandı. O diyarı fəth edəndən sonra Amid şəhərində qışlaq etdi və baharda çoxlu ordu ilə Tərcana gəldi.

O tərəfdən Cahanşah padşah Xoy qışlağından çıxıb güclü bir ordunu Əxlata göndərdi. Çünki kürdlər o diyarı tutmuşdular. Eyni zamanda Həsən padşahın yanına elçilər göndərib xəbər verdi ki, "qoşunumuzun Əxlat tərəfə getməsi üzündən ağlına qətiyyən pis fikirlər gəlməsin". Həsən padşah əhd-peyman bağladıqdan sonra həbsdə qalmış Əlişəkər bəyi də Cahanşah padşaha göndərdi.

### Sultan Hüseyn mirzə Bayqaranın əhvalatının bir qismi, onun Cürcan məmləkətini ələ keçirməsi və türkman qoşununun fərar etməsi haqqında söhbət

Mirzə Şahmahmud, Mirzə İbrahimə məğlub olandan sonra Mirzə Səncər, Sultan Hüseyn mirzəni Mərvdə qoyub hərəkət bayrağını Məşhədə doğru qaldırdı. Sultan Hüseyn mirzə ilə Mirzə Səncərin yaxınlarından olan Həsən Orlat arasında ədavət peyda oldu. Həsən onu tutmaq istədi. O həzrət xəbərdar olub, beş nəfərlə ata minərək şəhərdən qaçdı. O əsnada Canəli Yasavul cövşən geymiş bahadırlardan altmış nəfərlə onun xidmətinə yetdi. Mirzə[1078] onların mövcudluğu ilə güc qazanıb Mərvə qayıtdı və qalanı tutub istila bayrağını qaldırdı.

Ertəsi gün Mirzə Səncərin mülazimlərindən Məhəmməd bəy Şirazi, Şeyx Zünnun İraqi və Əmir Eloğlu ittifaq edərək, Sultan Hüseyn mirzə ov üçün şəhərdən getdiyi vaxt onun mülazimlərinin üstünə tökülüşüb hamısını qətlə yetirdilər. Bu xəbər Sultan Hüseyn mirzəyə çatdıqda, səf yaran bahadırlardan altmış nəfərlə bürcə çıxıb savaşa başladı. Şəhərlilər hücum etdilər. Sultan Hüseyn mirzə Bəndi-sultan[1079] tərəfə qaçdı. O zaman Həsən[1080] Çərkəz iki yüz nəfərlə ona qoşuldu.

Eyni zamanda Mirzə Səncər Mərvdən gəlib, Sultan Hüseyn mirzə ilə vuruşmaq üçün bir dəstə göndərdi. Onlar Təlxətan ətrafında[1081] Sultan Hüseynlə döyüşüb qalib gəldilər. Sultan Hüseyn mirzə Maruçaqa[1082] gəlib oradan Xivəq çölünə yönəldi. O əsnada Baba Həsən Cürcan vilayətində türkman qoşunundan fə-

[1076] Tarmuq (Tarmuh) – Murad çayı ilə Tərcan ovası arasında və ya Ərzincanın cənub-şərqində olduğu anlaşılır *(Öztürk, şərhlər, s.382).*

[1077] Ə.Nəvainin "Məxaç" deyə yazdığı bu qalanın adı mənbənin əlyazma nüsxələrində "Məhaq" şəklində qeyd edilmişdir. "Kitabi-Diyarbəkriyyə"də isə bu yerin adının Səmaqar olduğu göstərilmişdir. Səməqar (Samaqar) – Şərqi-Anadoluda, Oltu ilə Tortum arasında, Oltunun Narman nahiyəsində yerləşir *(Öztürk, şərhlər, s.382).*

[1078] Yəni Sultan Hüseyn mirzə Bayqara.

[1079] Bəndi-sultan (və ya Sultan-bənd) – Mərv şəhəri yaxınlığında, Mürğab çayından çəkilmiş su kanalı *(Э.Мефтах. Историческая география Мургаба-Мерва и Мерверруда // Мерв-наме – Книга о Мерве. Ашкабат, 2003, с.79).*

[1080] Mənbənin nüsxələrində Hüseyn yazılmış, lakin Ə.Nəvai "Həbibüs-siyər"ə əsaslanaraq Həsən şəklində təshih etmişdir *(Nəvai, s.586).*

[1081] "Həbibüs-siyər"ə görə: "Mərv və Təlxətan arasında". Paris nüsxəsində Püli-Əxtan (Əxtan körpüsü) yazılmışdır *(Nəvai, şərhlər, s.586).* Təlxətan – Mərv yaxınlığındadır.

[1082] Maruçaq – Mərv yaxınlığında, Mürğab bölgəsində tarixi şəhər *(Э.Мефтах. Историческая география Мургаба-Мерва и Мерверруда, с.105).*

rar edib Mərv vilayətinə üz tutmuşdu. Nisa ətrafında o, Sultan Hüseyn mirzə ilə ağır bir döyüş etdi. Baba Həsən öldürüldü.

Sultan Hüseyn köhlən atının yüyənini Cürcan tərəfə döndərdi və yol əsnasında Əmir Babur mirzənin əmirləri silkində qərar tutmuş Əmir Xudadad İsfərayindən gəlib, zəfərə yaxın olan əsgərlərə qoşuldu. O tərəfdən Cahanşah padşahın adından Astarabad hakimi olan Hüseyn bəy Səədlü qızmış aslan kimi Cürcan cəngəlliyindən çıxdı. Sultan meydanı [adlı] yerdə iki qoşun qarşı-qarşıya gəldi. [Allahdan] yardım alan qalibiyyətli padşah (Sultan Hüseyn mirzə) qəhr olmuş düşmənlərə həmlə edib onları pərən-pərən saldı. Hüseyn bəy Səədlü bir dəstə türkman igidləri ilə birlikdə əsir alındı. Onlar qəhr edən qəhrəmanın fərmanı ilə qətlə yetirildilər. Sultan Hüseyn mirzə zilhiccənin (10.10-07.11.1458) əvvəllərində kamına yetmiş və arzusuna çatmış halda Cürcan bölgəsinə daxil olub səltənət taxtına qədəm qoydu. Ordu başçıları ərz etdilər:

- Bayram[1083] xütbəsini Sultan Əbu-Səidin ləqəbləri ilə bəzəyək ki, iki tərəf arasında uzlaşma yolu açılsın.

O həzrət qəbul etməyib buyurdu ki, xütbəni öz adına oxusunlar. O halda Sultan Əbu-Səidin elçisi gəldi və məhəbbət izhar edən bir məktub təqdim etdi. Məzmunu belə idi ki, o qardaş gərək türkman ordusunu və bu xanədanın düşmənlərini dəf etmək istiqamətində səy göstərsin və ələ keçirdiyi hər vilayət onun olsun. Sultan Hüseyn mirzə elçilərə ənam verməklə nəvaziş göstərdi və Sultan Əbu-Səidin hüzuruna çoxlu töhfələr göndərdi.

## 863-CÜ İLDƏ (08.11.1458 – 27.10.1459) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Rum padşahı Sultan Məhəmmədin Kastamonu, Sinop və Trabzon şəhərlərini tutması[1084]

Bu il Rum padşahı Sultan Məhəmməd hərəkət bayrağını Trabzon vilayətinə doğru qaldırdı. İsfəndiyar övladlarından olan Kastamonu hakimi İsmayıl bəy o ali mənşəli padşaha tabe və sadiq olduğunu iddia edirdi və onun məmləkəti Trabzon yolu üzərində idi. Bu üzdən sultan sədaqət hisslərini hərəkətə keçirmək və uzlaşmanın zərurətlərinin yerinə yetirilməsini təmin etmək üçün İsmayıl bəyə məktub göndərdi. Məzmunu belə idi: “Allaha həmd və şükür olsun ki, bəxtiyar səltənətimizin günəşinin doğmasının, əzəmət və səadət sübhümüzün açılmasının başlanğıcından bəri vahidlik dərgahından və əbədilik bargahından “Biz səni yer üzündə xəlifə etdik”[1085] kəramətinin tacı bizim dövlətimizin başına qoyulmuşdur və cahanın idarəçiliyinin yüyəni bizim əlimizə verilmişdir. Hansı tərəfə üz tuturuqsa, tale bizi məqsədimizə yetirir və murad qapıları bizim dövlətimizin üzünə açılır. Bu müqəddimədən məqsəd budur ki, müzəffər əsgərlərimiz Trabzon diyarına doğru hərəkət edirlər. Gəmilərimiz Sinopdan[1086] keçəcəklər və qələbə ayəli bayraqlar bir dəstə savaş bahadırları ilə quru yolundan, sizin diyarınızın yaxınlığından gedəcəklər. Xahişimiz budur ki, tam köməklik göstərəsiniz və özünüz də hazırlıqlı qoşun və növrəstə cavanlarla hökmdarın ordusuna qoşulasınız”.

O əsnada İsmayıl bəyin qardaşı olan və irsi mülk üstündə yaranmış münaqişə üzündən qardaşı ilə tamamilə düşmənçilik edən Qızıl Əhməd, sultanın hüzuruna gəldi. Lakin İsfəndiyaroğlu (İsmayıl bəy) sultanın dərgahına getmədi. O səbəbdən sultanın qəzəb atəşi şölələndi və onun orduda olan oğlu Həsən Çələbini tutub həbs etdi. Həmçinin Sultan Murad tərəfindən İsmayılın babası Kötürüm Bayəzidə[1087] bağışlanmış mis mədənini geri aldı və vəziri-əzəm Mahmud paşanı Qızıl Əhmədlə birlikdə İsmayıl bəyi dəf etməyə göndərdi. Onlar İsmayıl bəyi Sinop qalasında mühasirə etdilər. Mahmud paşa əqli və nəqli dəlillərlə İsmayıl bəyi razı saldı. Ona görə də İsmayıl bəy dikbaşlıq zirvəsindən miskinlik və yazıqlıq çökəkliyinə düşdü, bəndəlik və sədaqət dairəsi içinə qədəm qoydu və Sultan Murad dövründə onun ata-babasına göstərilmiş mərhəmət və qayğı təzələndi. O, qaladan çıxıb Mahmud paşa ilə görüşdü. Sultan Sinop ətrafına gəldikdə böyük əmirlər onu sultanın məclisinə gətirdilər. Sultan ona ehtiram əlaməti olaraq, bargahdan eşiyə qədəm qoydu, ona mehribanlıq

---

1083 Qurban Bayramı nəzərdə tutulur (10 zilhiccə).

1084 Əslində bu hadisələr 1461-ci ildə baş vermişdir *(Osmanlı tarihi el kitabı, s.93-95).*

1085 *Qurani-Kərim, “Sad” surəsi, 26-cı ayə.*

1086 Sinop – Türkiyənin Qara dəniz sahillərində şəhər. O zamanlar bu liman şəhəri Kastamonuda hökm sürən Candaroğulları (İsfəndiyaroğulları) bəyliyinin əlində idi.

1087 Kötürüm Bayəzid – 1361-1385-ci illərdə Candaroğulları bəyliyinin başçısı olmuşdur *(Y.Yücel. Candaroğulları // TDVİA, cilt: 7, yıl: 1993, s.147).*

göstərdi və Yengişəhəri[1088] yan-yörəsi və çevrəsi ilə birlikdə ona verdi. İndi ki hicri tarixi 980-ə (14.05.1472 – 02.05.1473) çatmışdır, onun övladlarının bəziləri Sultan Səlimin[1089] xidmətində münasib mənsəblərin sahibidirlər.

Kastamonu və Sinopun fəthindən sonra Sultan Məhəmməd qaraltısı cahanın enişini və yoxuşunu tutmuş, eni və uzunu qurunun və dənizin hüdudlarını aşmış olan güclü bir ordu ilə Trabzona yola düşdü. Qoyluhisarın[1090] ətrafı izdihamlı əsgərlərin dayanacaq yeri olduqda o diyarın valisi Yarəli bəy Diyarbəkr hakimi Həsən padşah Bayandurdan kömək istədi. Həsən padşah Trabzon hakiminin kürəkəni olduğu üçün Ağqoyunlu qoşunlarını toplayıb on min nəfərlə Kəmax dağının daşlıq zirvəzində mövqe tutdu. Əsgərlər ətrafdan və yan-yörədən gəlib həmlə etdilər. Amma sultanın yüz qat artıq əzəməti və şövkəti müqabilində türkmanların qarşıdurma və müharibə etməyə imkanları yox idi və onlar qətiyyən heç bir yerdə özlərini göstərmirdilər.

O əsnada Şahsüvar Zülqədər[1091], Süleyman bəy, Ankara və Bursa valisi Fərhad bəy sancaq əmirlərindən iyirmi nəfərlə döyüş və savaş əzmi ilə ata minib türkmanların üstünə getdilər. O tərəfdən də Həsən padşahın qardaşı oğlu Yusif bəy, Məhmad bəy, Yarəli bəy və Əmir bəy Mosullu Aqğqoyunlu bahadırlarının bir dəstəsi ilə onların qarşısına çıxdılar. Ağır bir döyüş oldu. Rum qoşunu məğlubiyyətə uğradı. Onlardan iki yüz nəfər qətlə yetirildi və daha altmış nəfər əsir alındı. Bir neçə gün sonra Ərzincan yaxınlığındakı Yıldız dağında Həsən padşah öz əmisi oğlu Xurşid bəyi əksər Ağqoyunlu qoşunu ilə pusquda qoydu.

O əsnada Gedük Əhməd paşa rumilərdən [ibarət] bir dəstə ilə oradan keçirdi. Onlar qəflətən pusqudan çıxıb keçid yerində özlərini Əhməd paşaya yetirdilər.

Beyt

“Elə ki çıxdı türkman pusqudan,
Titrədi onların qorxusundan yer”.

Ağır bir döyüş baş verdi. Əhməd paşa türkman qoşununu məğlub edib, Həsən padşahın ordugahına qədər qovdu. O həzrətin ürəyini tamamilə xof bürüdü, öz anasını bir sıra etibarlı adamlarla üzrxahlıq mərasimini yerinə yetirmək üçün ali mənşəli sultanın hüzuruna göndərdi. Onlar vəziri-əzəm Mahmud paşanı vasitəçi etdilər. Sultan da inanılmış mülazimlərindən birini Həsən padşahın yanına göndərib xəbər verdi ki: “Din və dövlət üçün faydalı olan iş bu idi ki, o şücaətli cənab (Həsən padşah) bir dəstə ordu ilə bu səfərdə qazilərə yoldaş olaydı. Lakin bəzi xoşagəlməz maneələr onun bu ali mətləbi dərk etməsinə əngəl oldu. İndi ki öz anasını və adamlarını göndərmişdir, biz o ərazinin (Trabzonun) fəthindən sonra onları geri göndərəcəyik”.

Sultan Qoyluhisarın fəthindən sonra Trabzona yönəldi. Bayburddan Mahmud paşa zəfər bayraqlı bəzi əsgərlərlə mənqəlay [təyin] edildi. Bundan əvvəl dəniz yolu ilə döyüşçülərlə dolu olan, saysız top-tüfəngə malik çoxlu gəmi [oraya] getmişdi. Gəmi qoşunu murad küləyinin hərəkətləndirməsi ilə ali bayraqlardan öncə sözügedən qalanın ətrafına çatdı. Zəfər nişanlı ordu dəniz və quru tərəfdən hücuma keçdi. Trabzon hakimi əsla onlara məhəl qoymadı və düşündü ki, yüksək şanlı sultanın sayı ulduzlar qədər olan belə bir qoşunla dağların və təpələrin dar cığırlarından keçməsi mümkün deyil. Ertəsi gün sağdan və soldan, düzənlikdən və dağlıqdan sultan əsgərlərinin növbənöv səfləri dəstə-dəstə təpədən və dağdan çıxdılar.

Şeir

“Bir dəstə vardı və onun içində min dəstə,
Hər bir dəstə izdihamlı bir qoşun idi.
Hamının bədəni sipərli, əli qılınclı, barmağı oxlu,
Hamısı ordu qıran, div tutan, aslan ovlayan”.

Bəxti kor olan Təkfurun[1092] dövlət bəbəyi sultanın bayraqlarının muncuğunun parıltısından qaraldı və onun ümid gözü tutuldu. O çalışqan və fəal sultanın uğur bayraqlarının gəlişi ilə özünün mülkünün və malının zavala uğramasının əlamətlərini müşahidə etdikdən sonra həmin mühasirəyə alınmış qaladan çıxıb getməyə və bəzi uzaq qalalara sığınmağa fürsəti olmadı. Onun ürəyini tamamilə xof bürüdü, qaladan çıxıb tabe-

---

[1088] Yenişehir nəzərdə tutulur. Yenişehir – Türkiyənin Bursa vilayətində ilçə mərkəzidir və Bursa şəhərindən şərq tərəfdə yerləşir.

[1089] Sultan Süleymanın oğlu II Səlim nəzərdə tutulur.

[1090] Mətndə: “Qoyunlu-hisar”. Qoylu-hisar (Koyluhisar) – Türkiyənin Sivas vilayətinin şimalında yerləşən bir ilçədir.

[1091] Şahsüvar – Zülqədər bəyliyinin əmiri, Mərəş, Əlbistan və Malatya hakimi olan Süleyman bəyin oğlu idi və Osmanlılara xidmət edirdi *(Nəvai, şərhlər, s.590).*

[1092] Son Trabzon imperatoru David Komnen nəzərdə tutulur *(Nəvai, şərhlər, s.593).*

çilik başını itaət zəmininə qoydu. Sultan onun təqsirlərindən keçib onu bütün malları, yükləri və arvad-uşağı ilə birlikdə darüssəltənə İstanbula göndərdi və onun üçün bir vəzifə müəyyənləşdirdi. Trabzonu inanılmış mülazimlərinə tapşırıb Canik[1093] vilayəti yolundan Toqat[1094] şəhərinə döndü. Amma yolların və keçidlərin çətinliyindən, otların zərərindən və təhlükələrdən müzəffər sultanın əsgərlərinin minik heyvanlarına çoxlu nöqsan üz verdi.

**Azərbaycan diyarında baş vermiş hadisələr, Cahanşah padşahın oğlu Həsənəlinin [həbsdən] çıxması və onun Azərbaycanı ələ keçirməsi haqqında söhbət**

Türkman padşahı Cahanşahın Xorasanda olduğu vaxt Maku[1095] qalasında on beş il həbsdə qalan oğlu Həsənəli məhbusluqdan xilas olub Əmir Ərəbşah Ayinlünü və Həsən padşahın əmisi Mahmud bəy Ağqoyunlunu da həbsdən buraxdı və onlarla ittifaq halında Təbrizi ələ keçirdi. O, əmirlərin arvadlarını öz nökərlərinə bağışladı. Məmləkətlərin və yolların ətrafından və yan-yörəsindən avaralar və alçaqlar o yaramazın yanına yığışdılar. Bu möhnətli xəbər o alinəsəb padşahın qulağına çatdıqda, daha öncə qeyd edildiyi kimi, Sultan Əbu-Səidlə sülh bağladı.

Bu əsnada Həsənəli, Əmir Qılıc Aslanla Mahmud bəy Ağqoyunlunu Ərdəbilə tərəf göndərdi. Onlar yüksək şanlı padşahın qorxusundan Həsənəlidən üz döndərib Cahanşahın hüzuruna gəldilər. Zəfərə yaxın olan hökmdar Şahsüvar bəyi, Savalan bəyi, Əlişəkəroğlu Pirəlini çoxlu ordu ilə təcili surətdə Təbrizə göndərdi.

Bədbəxt Həsənəli atasının gəlişindən xəbərdar olduqda, Təbrizi tərk edərək fərar yolunu tutdu. Böyük əmirlər müzəffər əsgərlərlə Təbrizə gəldilər. Həsənəli, Cahanşah padşahın hələ İraqda olduğunu müəyyənləşdirdiyi üçün Həsunoğlunu bir dəstə bahadırlarla Təbrizə yolladı. Əmirlər şəhərdən çıxıb Abi-şor (Acısu və ya Acıçay) kənarında o qürurlu dəstə ilə döyüşdülər və Həsunoğlunu igidlik meydanı süvarilərindən [ibarət] bir dəstə ilə birlikdə qətlə yetirdilər.

Bu xəbər Həsənəliyə çatdıqda o aqibətsizin ürəyini tamamilə xof bürüdü və o, Maku qalasına tərəf getdi. Cahanşah padşah Təbrizə hərəkət etdi. Təbriz şəhərinin bütün rəiyyəti yol üstünə çıxdı və növbənöv töhfələr və hədiyyələr gətirdilər. Hökmdarın dövlətinin parlaqlığından dövlətxana (dövlət sarayı) fələyə həsəd bəxş etdi. Rəiyyət zülmün zülmətindən qurtulub həyat çeşməsinə yetişdi və camaat ədalət və insaf meşəliyində rahatlandı. Zəmanənin hadisələrinin təpiyi altında qalmış və gecə-gündüzün fəlakətlərindən canları dodaqlarına gəlmiş, bıçaq sümüklərinə dirənmiş o diyarın bəla çəkmişləri və o ölkənin incidilmişləri yalvar-yaxar etmək üçün dərgaha gəldilər.

Cahanşah padşah, Əmir Ərəbşahı divan əmiri [təyin] etdi, Əmir Pirzad Buxari ilə Savalan bəyi də ali mənsəblərə yüksəltdi. Həsənəli ilə ittifaq etmiş hər kəsi isə qətlə yetirdi və Həsənəliyə bir məktub (nişan) göndərdi. Məzmunu belə idi: “Əgər bu fitnənin xəmirinin mayası olan əmirini və vəzirini qətlə yetirsən və onların kəllələrini dərgahımıza göndərsən, biz sənə aman verərik və sənin günahların üzərinə əfv kölgəsi salarıq”. Ona görə də Həsənəli öz atasının buyruğuna əməl edib, vəziri Xoca Şəmsəddin Hüseynin və öz məxsusi adamlarından bəzilərinin boynunu vuraraq başlarını atasının dərgahına göndərdi və xahiş etdi ki, “bacım gəlsin və məni ərşə bənzər dərgaha aparsın”.

Cahanşah padşah onun bacılarından birini göndərdi ki, onu Səhənd yaylağına gətirsin. Əmirlər onu qarşılamağa tələsib onu hökmdarın ordugahına daxil etdilər. Ertəsi gün o hünərsiz, boynuna bir dəsmal atıb atasının önünə gəldi və münasib bir yerdə əyləşdi. Əmir Ərəbşah da həmin məclisdə idi. Həsənəli, Əmir Ərəbşahın padşah haqqında dediyi ədəbsiz sözləri orada ərz etdi.

Bir neçə gün sonra səadətli hökmdar buyurdu ki, “əmirlər ova çıxmaq üçü ata minsinlər və Həsənəlini bəla toruna əsir etsinlər”. Ona görə də Əbülfəth bəy Cagirlü, Pir Məhəmməd Təvaçı, Pirzad bəy, Savalan bəy və b. əmirlər ata mindilər. Həsənəli onların hərəkətindən xəbərdar olduqda, qaçış atına minərək atasının mənzilinə yollandı. Pir Məhəmməd Təvaçı onu təqib edib ona bir ox vurdu. Həsənəli özünü atasının hərəm-

[1093] Canik – Türkiyənin Samsun vilayətinin bir ilçəsi.
[1094] Toqat – Türkiyənin Amasya və Sivas şəhərləri arasında, Yaşılirmaq çayı dərəsində yerləşən şəhər.
[1095] Maku – Cənubi Azərbaycanın şimal-qərbində, Azərbaycanın Naxçıvan şəhəri ilə Türkiyənin Doğubeyazıt şəhəri arasında yerləşir.

xanasına saldı. Digər övladların anası olan Xatuncan bəyim o dövlətsizin boynuna bir dəsmal salıb onun günahının bağışlanmasını istədi. Amma bir müddət sonra atası onun öz dövlətinin ərazisindən çıxarılması barədə hökm verdi. Onun qardaşı Pirbudaq həmin zaman Bağdadda müxaliflik izhar etdiyi üçün [Cahanşah] istəyirdi ki, Bağdadı onun əlindən alsın və Pirbudağın qərarlaşmağa və sığınmağa yeri qalmasın. O, Həsənəlini bəyimə tapşırdı ki, onu Bağdad yolundan Şam hüduduna çatdırsın və hiylə ilə Bağdadı ondan geri alsın.

Bu xəbər Pirbudağa çatdıqda rədd əlini onların xahiş sinəsinin üzərinə vurdu. Ona görə də bəyim Həsənəlini Bağdad ətrafından keçirib Şama göndərdi və Mirzə Pirbudaq tərəfindən Nətənzin mallarının (vergilərinin) mənimsənilməsinin əvəzində, dönüş zamanı əlli min ailədən ibarət Qara ulusunu köçürüb Azərbaycana gətirdi.

**Sultan Əbu-Səid mirzənin Mirzə Əlaüddövlə və Mirzə Səncərlə müharibə etməsi haqqında söhbət**

Sultan Əbu-Səid Herat şəhərində qışlaq etdiyi üçün [yanında] təqribən iki min nəfər yaxşı silahlanmış süvari saxlayaraq ordunun qalanını Səmərqənd tərəfə göndərdi. Mirzə Əlaüddövlə, Mirzə İbrahim və Mirzə Səncər ədalətli hökmdarın ordusunun azlığından xəbər tutub Sərəxsdə bir-biri ilə birləşdilər. Bu möhnətli xəbər alinəsəb padşaha çatdıqda azsaylı ordusu ilə müxaliflərin üzərinə hərəkət etdi. Bu vaxt dövlətin mütləq şəkildə əsasını təşkil edən ittifaq zərurəti üzündən Əmir Seyid Məzid Ərğun və Əmir Sultan Əhməd Teymurtaş həddən artıq izdihamlı qoşunla Səmərqənddən gəlib çataraq hökmdarın ordusuna qoşuldular.

Cəmadiyüləvvəl [ayının] (06.03-04.04.1459) ortalarında Mərv və Sərəxs arasında qarşıdurma və vuruşma baş verdi. Çoxlu çalış-vuruşdan sonra zəfər şüarlı qoşunların sağ və sol cinahları ali mənşəli şahzadələrin həmləsi qarşısında fərar etdilər. Belə ki, Səmərqəndə qədər heç bir yerdə dayanmadılar.

Nəzm

“O döyüş meydanında müxaliflərə məğlub oldu,
Yerindən dəbərdi sağ və sol cinah.
Süvarilərin tozundan cahan qaraldı,
Qoşuna pərakəndəlik yol tapdı”.

Sağ və sol cinahların fərar etməsindən sonra Sultan Əbu-Səid mərkəz (qol) qoşunu ilə müxaliflərin mərkəzinə (qəlbinə) həmlə etdi.

Beyt

“Elə ki şah düşmənlərin üzərinə at çapdı,
Uşaqlarla oynayan kimi onlarla oynadı”.

Mirzə Əlaüddövlə, Mirzə Səncər və Mirzə İbrahim kədərdən və qəmdən iki parça olmuş ürəkləri ilə fərar vadisinə üz qoydular. Əmir Seyid Muradın nizə zərbəsi ilə Mirzə Səncər yaralanıb əsir düşdü və ədalətli sultanın fərmanı ilə qətlə yetirildi. Onun əmirlərindən Şeyx Zünnun və Məhəmməd bəy ölüm şərbətini içdilər. O uğursuz dəstədən bir çoxları oxa və qılınca yem oldular. Mirzə Əlaüddövlə və Mirzə İbrahim meydanın cövlangahından Məzinan[1096] mövqeyinə qədər heç yerdə aram tutmadılar. Şairlərdən biri o əhvalat haqqında demişdir:

Beyt

“Əlaüddövlə mirzə qaçır savaşdan,
Lap ordusunda Fəridun[1097] olsa belə.
Oğlu əgər qaçsa, bunu ona ayıb bilmə,
Axı o hünərsizdən hünərli necə törəyə bilər?!”

Sultan Əbu-Səid, Əmir Əli Farsini və Əmir Seyid Əsili müxalifləri təqib etməyə göndərdi. Onlar zəfər nişanlı qoşunların qorxusundan bir-birindən ayrıldılar: bir dəstəsi Bistam tərəfə getdi və Mirzə Salehin oğlu Əmir Xəlil, Barlas əmirləri və digər camaat Mirzə Əlaüddövlədən və Mirzə İbrahimdən ayrılıb Astarabada getdilər. Sultan Hüseyn mirzə Əmir Xəlili qətlə yetirib digərlərini həbs etdi. Ona görə ki, Mirzə İbrahim o həndəvərə çatmışdı.

---

[1096] Məzinan – İranın Səbzəvar vilayətində bir məntəqə *(Nəvai, şərhlər, s.597).*
[1097] Fəridun – Firdovsinin “Şahnamə” poemasının qəhrəmanlarındandır.

Həmçinin bu arada "Mətləüs-səadeyn" kitabının müəllifi Mövlana Əbdürrəzzaq Səmərqəndi[1098], Sultan Əbu-Səidin yanından elçi kimi gəlmişdi. Sultan Hüseyn mirzə cənab Mövlanaya ehtiram göstərib Sultan Əbu-Səidin adına xütbə oxutdu və sikkə vurdurdu.

Səadət nişanlı sultan müxaliflərin işindən xatircəm olduqdan sonra çalışqanlıq kəməndini Nərətu qalasını ələ keçirmək üçün atdı və dağla müqabil olan o qalanı mühasirə etmək üçün bir dəstə təyin etdi. Əlahəzrətin mülazimləri bu işlə məşğul olduqları zaman Birkə qala əhlinə qarşı etimadsızlıq göstərib onların bir dəstəsini qətlə yetirdi. Qılıncdan qurtulanlar ondan vahimələnib onun üzərinə töküldülər və onun şərlə dolu başını bədənindən ayırıb Sultan Əbu-Səidin dərgahına göndərdilər. Bu xidmət səbəbindən onlar Sultan Əbu-Səidin iltifatına layiq görüldülər.

Həmçinin bu il Sultan Əbu-Səid, Əmir Əli Farsini[1099] İmad qalasını fəth etməyə göndərdi. Baba Həsənin tərəfindən o qalanın hakimi olan Məhəmməd Divanə qalanın açarını təhvil verib hökmdarın dərgahına yola düşdü. Əmir Əli Farsi hökmə uyğun olaraq, qalanı viran etdi.

Həmçinin bu il Heratda qəhətlik o dərəcəyə çatdı ki, çörəkdən nişan qalmadı və hər gün yetmiş-səksən adam aclıqdan can verirdi.

### Ölümlər

Daha öncə qeyd edildiyi kimi, Mirzə Baburun tərəfindən Mərvi-Şahican hakimi olan Mirzə Səncər ibn Mirzə Əhməd ibn Mirzə Ömərşeyx ibn Əmir Teymur bu il öldürüldü.

Həmçinin bu il Mirzə Sultan İbrahim ibn Mirzə Əlaüddövlə ibn Mirzə Baysunqur ibn Şahrux padşah ibn Cahangir Sahibqiran Əmir Teymur Kürəkan Sərəxs döyüşündən qurtulduqdan sonra Damğanda atasından ayrılıb müqəddəs Məşhədə yönəldi və başına çoxlu qoşun toplandı. O zaman ona təhlükəli xəstəlik üz verdi və o, dünyadan köçdü. Bəzi mülazimləri onun cəsədini Herata gətirdilər və Gövhərşad bəyim mədrəsəsində dəfn etdilər. Səltənətinin müddəti iki ildən artıq idi.

Həmçinin bu il Mirzə Səncərin əhvalatından öncə Mirzə Şahmahmud ibn Mirzə Babur ibn Baysunqur ibn Şahrux ibn Teymur Sistanda Əmir Xəlilə qoşuldu və onlar birlikdə Kabilə yollandılar. O diyarın hakimi Əmir Baba qəflətən onların üzərinə hücum edib Şahmahmuda bir ox vurdu və o, elə həmin yaradan öldü.

Bu il Cahanşah padşahın əmirlərindən olan Əmir Bayəzid ibn Əmir Bistam Cagirlü dünyadan köçdü və qardaşı Əbülfəth bəy onun yerinə keçdi.

## 864-CÜ İLİN (28.10.1459 – 16.10.1460) HADİSƏLƏRİ HAQQINDA

### Rəhmətlik Sultan Cüneyd Səfəvinin əhvalatı və onun şəhidliyi

Sultan Cüneyd – Allah dəlilini nurlandırsın – irşad kürsüsünə əyləşdikdə Cahanşah padşah övliyalıq taxtının padşahı olan Sultan Xoca Əlinin övladlarından Şeyx Cəfərə[1100] [xəbər] göndərdi ki, "o həzrəti Ərdəbildən xaric edin!". Şeyx Cəfər, Cahanşah padşahın qızlarından birini öz oğlu Seyid Qasıma nikahladığı üçün o cənabın (Cüneydin) yanına bir şəxs göndərib, şəhərdə qalmamasını istədi.

Sultan Cüneyd öz müridlərindən [ibarət] çoxsaylı bir dəstə ilə vətənindən Diyarbəkrə doğru hərəkətə gəldi. Həsənkeyfə çatdıqda, Diyarbəkr hökmdarı olan və Cahanşah padşahla düşmənçilik edən Həsən padşah o həzrətə bir məktub göndərib öz sədaqətini və etiqadını izhar etdi. Sultan Cüneyd sevincək olub onunla görüşdü. [Həsən padşah] özünün Xədicə bəyim adlı bacısını o həzrətə ərə verdi.

---

[1098] "Mətləüs-səadeyn" (tam adı: "Mətləüs-səadeyn və məcməül-bəhreyn", yəni "İki uğurlu ulduzun doğduğu və iki dənizin qovuşduğu yer") – Teymurilərin saray tarixçisi Kəmaləddin Əbdürrəzzaq ibn Cəmaləddin İshaq Səmərqəndinin (1413-1482) iki qismdən ibarət mühüm tarixi salnaməsidir. Bu əsər Elxani hökmdarı Əbu-Səidin h. 704 / m. 1304-05-ci ildə anadan olması ilə başlayıb, 875 / 1470-ci ildə, Teymuri hökmdarı Sultan Hüseyn Bayqaranın hakimiyyətinin başlanğıcında sona çatır *(Ч.А.Стори. Персидская литература, ч. II, с.820-828).*

[1099] Tam adı Əmir Qiyasəddin Əli Farsi Barlas idi *(Nəvai, şərhlər, s.599).*

[1100] Şeyx Cəfər – Şeyx Cüneydin əmisi idi.

Sultan Cüneyd dörd il müddətində orada qaldı. On iki min nəfər sadiq və səmimi sufi o həzrətin irşadı (yol göstərməsi) ilə doğru yola gəldi. O, həmin diyarda çoxlu xəlifələr[1101] təyin etdi və Ərdəbil tərəfə qayıtdı.

Cahanşah padşah onun Həsən padşahla qohum olduğunu eşitmişdi. Ona görə yenə də onu [Ərdəbildən] çıxarmaq fikrinə düşdü. Sultan Cüneyd də bu il Ərdəbildən çıxıb şəhərin xaricində bir neçə gün qaldı və ətrafa, yan-yörəyə adamlar göndərib müridlərini çağırdı. Qısa zamanda on iki min cavan o həzrətin bayraqlarının kölgəsində toplandı. Ona görə də o həzrət hərəkət bayrağını Şirvana doğru çevirdi. Şirvan valisi Əmir Xəlilulla – Allah onun məqamını cəhənnəm etsin – mələklər kimi varid olan qoşunların gəlişindən agah olduqda vahiməyə qapılıb öz inanılmış adamlarını çoxlu töhfələrlə sultanın dərgahına göndərdi və “vilayət”[1102] nişanlı sultanın gəlişini təbrik etdi.

Elə bu zaman Şeyx Cəfərdən şirvanşaha bir məktub çatdı. Məzmunu belə idi: “Vilayət” xanədanının müridlərindən və kəramət ailəsinə etiqad edənlərdən [ibarət] bir dəstə Şeyx Cüneydi yüksək məqamlı atasına görə özlərinə mürşid[1103] bilmiş və onun göstərdiyi yolla getmişlər. Halbuki Şeyx Cüneyd bu mənada yalançıdır və onun xilafəti və mürşidliyi həqiqətə uyğun deyildir. Qarşıda duran ən birinci məsələ onun dəf edilməsi üçün səy göstərməkdir”.

Ondan sonra Əmir Xəlilulla hədsiz-hesabsız bir qoşunla hərəkət yüyənini Sultan Cüneydin qoşununa doğru çevirdi. Pəncşənbə günü, cəmadiyüləvvəl [ayının] 10-da (03.03.1460)[1104] iki qoşunun yaxınlaşması qarşıdurma ilə nəticələndi.

Nəzm

“Çatdılar şirvanlılar dəstə-dəstə,
Zireh geymişlər üzündən bütün çöl dalğalandı.
Beyinləri əndişədən xali olan halda gəldilər,
Pərvanə kimi çırağa doğru gəldilər”.

Cövşən geymiş dilavərlərdən və coşub-kükrəyən mübarizlərdən [ibarət] olan sufilər qoşunu dəstə-dəstə döyüş və vuruş meydanına atıldılar. Fitnə dəryasının dalğaları təlatümə gəldi. Qorxmaz igidlər və düşmən qıran mübarizlər bir-birinin üstünə düşdülər. O iki qantökən qoşun və o iki fitnə qoparan tayfa qiyamət gününün əlamətlərini zühura gətirdilər və bir-birinin başına xəncər və qılınc vurdular. Səfəvi xanədanının səltənət sübhünün doğmasına və Mustafa sülaləsinin murad gülünün açılmasına hələ bir möhlət və bir müddət qaldığı üçün Şirvanın yaramaz qoşunu sufilər dəstəsinə qalib gəldi. Bir bədbəxtin barmağından bir ox çıxıb o “vilayət” nişanlı sultanın ömrünün ipini qırdı.

Nəzm

“Fələk sübhü o qədər də işıqlı etmədi,
Çünki axşam qan şəfəqindən ətəyini çəkə bilmədi.
Gülşən tərəfdə gülmədi heç bir gül,
Çünki ağlamadı ətəyində bir bülbül”.

---

[1101] Xəlifə – sufilikdə təriqət başçısı (mürşid) tərəfindən müəyyən bölgələrdə təriqət adından təbliğat aparmaq səlahiyyəti (irşad icazəsi) verilmiş şəxslərə deyilirdi. Səfəvilərin hakimiyyəti dövründə xəlifələrin fəaliyyətini əlaqələndirmək və onlara ümumi başçılıq etmək üçün “xəlifətül-xüləfa” (“xəlifələr xəlifəsi”) vəzifəsi mövcud idi. Bu vəzifə haqqında bax: *О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.265-266; R.M.Savory. The Office of Khalifat al-Khulafa under the Safawids // Journal of the American Oriental Society, vol. 85, New-Haven, 1965, p.497-502; Z.H.Bayramlı. Səfəvi dövlətinin idarə quruluşunda xüləfa institutunun yeri // BDU-nun Xəbərləri (humanitar elmlər seriyası), 2004, № 2, s.165-174.*

[1102] Şiə inancına görə, islam aləmində hakimiyyət irsən yalnız Məhəmməd peyğəmbərin nəslinə, Əhli-beytə məxsus olmalıdır. Bu prinsip “müqəddəs hakimiyyət” məfhumunu bildirən “vilayət” termini ilə ifadə olunur. Sünnilərdən fərqli olaraq, şiələr peyğəmbərdən sonra ilk üç xəlifənin (Əbu-Bəkr, Ömər, Osman) hakimiyyətini legitim saymırlar. Onlar “vilayət” prinsipinə əsasən, islam dünyasında məhz peyğəmbərin əmisi oğlu və kürəkəni olan Həzrət Əli və onun peyğəmbərin qızı Fatimə xanımla izdivacından doğulmuş nəslinin nümayəndələrini peyğəmbərin davamçısı və varisi, islam ümmətinin xəlifəsi və imamı olmağa layiq görürlər. Özlərinin Məhəmməd peyğəmbər və Həzrət Əli nəslindən olduqlarını iddia edən Səfəvilər də siyasi və ideoloji mübarizə meydanında hakimiyyət məsələsi baxımından “vilayət” (peyğəmbər nəslinin hakimiyyəti) prinsipindən geniş surətdə istifadə edirdilər. Burada və bundan sonra şiə əqidəsindəki “vilayət” terminini inzibati ərazi vahidi olan vilayət sözündən fərqləndirmək üçün dırnaq içində yazacağıq.

[1103] Mürşid – ərəbcə “doğru yol göstərən” anlamına gəlir. Dini rəhbərlər və təriqət başçıları mürşid adlanırdılar.

[1104] Göstərilən miladi tarix həftənin düşənbə (bazar ertəsi) gününə təsadüf edir. V.Hinz isə bu hadisənin 4 mart 1460-cı il tarixində baş verdiyini yazır *(W.Hinz. Uzun Hasan ve Şeyh Cüneyd. Çev. T.Bıyıklıoğlu. Ankara, 1992, s.35).*

Üzüqara şirvanşah belə böyük günaha batmaqla özünü "Şübhəsiz ki, onun məskəni cəhənnəmdir!"[1105] məqamında qərarlaşdırdı və lənət boyunduruğunu öz uğursuz boynuna saldı.

### Xorasan diyarında baş vermiş hadisələr

Bu ilin əvvəllərində Sultan Hüseyn mirzənin qulağına çatdı ki, bəzi ərəb qəbilələri Viyarcəmənd[1106] hüdudunda yerləşmişlər və yoldan keçənlərə əziyyət verirlər. Buna görə də o, Əbdüləli Tərxanı bir dəstə bahadırlarla o camaatı ədəbləndirmək üçün yolladı.

Əbdüləli Tərxan o camaatı qətl etdikdən sonra Nişapur və Səbzəvar nahiyələrinə basqın edib istilaçılıq bayrağını yüksəltdi. Sultan Əbu-Səid, Əmir Əli Farsini, Əmir Həsən Şeyx Teymuru, Əmir Məzid Ərğunu və Əmir Nursəidi zəfərə öyrəşmiş bahadırlardan [ibarət] bir dəstə ilə Astarabada yolladı və özü də çaharşənbə günü, cəmadiyüləvvəl [ayının] 14-də (07.03.1460), günəş Balıq bürcünün on yeddinci dərəcəsində olduğu vaxt əmirlərin ardınca yola düşdü. Əbdüləli Tərxan onların sadəcə gəlişi ilə fərar etdi. Sultan Hüseyn mirzə şimşək və külək kimi Astarabaddan çıxdı. Sultanabad səhrasında o iki qoşun iki polad dağ kimi bir-birinin qarşısında dayandılar.

O əsnada xəbər çatdı ki, Sultan Əbu-Səid çoxlu ordu ilə döyüş meydanına yetişməkdədir. Ona görə də Sultan Hüseyn mirzənin ürəyini tamamilə xof bürüdü və o, Astarabad tərəfə qaçdı. Yol əsnasında Əhməd və Baba Yaqut cəlairlərdən [ibarət] bir qövmlə hökmdarın məiyyətindən üz döndərdilər. Sultan Hüseyn mirzə Astarabadı tərk edib, günəş kimi parlaq bayraqlarını Ağrınça və Əvaq bölgəsinə doğru qaldırdı. İfrat dərəcədə yağış yağdığı üçün zəfər nişanlı əsgərlər onu təqib edə və basqın qapılarını onun üzünə aça bilmədilər.

Sultan Hüseyn mirzə yeddi gündən sonra beş yüz nəfərlə birlikdə Amudərya çayı kənarına çatıb gəmi ilə [oradan] keçdi. Sultan Əbu-Səid o həzrətin fərarından sonra qələbə ilə hərəkətə keçdi. Astarabad şəhəri dindar və ədalətli hökmdarın qədəmlərinin uğuru sayəsində Şəddadın yeddi eyvanına həsəd bəxş etdikdə, o, həmin məmləkətin hakimliyini oğlu Sultan Mahmud mirzəyə həvalə edib Xorasan tərəfə geri döndü.

Sultan Əbu-Səidin olmadığı vaxt Sistan hakimi Əmir Xəlil Hindukə dikbaşlıq iddiası və baş qaldırmaq davası edib Sistanın avaralarından və alçaqlarından [ibarət] bir dəstə ilə hərəkət bayrağını Xorasana doğru qaldırdı. Herat bölükatının (ətrafının) camaatı bu qəziyyədən agah olduqda özlərini şəhərə saldılar və Əmir Əhməd Barlasla, Pəhləvan Məhəmməd Piyada ilə ittifaqda bürcü və qala divarını möhkəmləndirdilər.

Əmir Xəlil ramazan [ayının] 12-də (01.07.1460) Herat ətrafına gəlib döyüşə başladı. Sözügedən Əmir Xəlilin başında tük olmadığı üçün şair Mövlana Həsənşah bir qitə yazıb, onu bir oxa bağlayaraq onun tərəfinə atdı. Həmin qitə budur:

Qitə

"Ey dostlar, mənim sözümü çatdırın Xəlilə,
Deyin ki, əgər sənin başında baş oynatmaq istəyi varsa,
Oruc günündə bizə və özünə başağrısı vermə,
Bayram günündə gəl ki, balqabaq oynatmaq vaxtıdır"[1107].

Əmir Xəlil bu qitəni oxuduqda xəcalət çəkdi. Cümə günü Herat camaatı rəşadət ayağını darvazadan eşiyə qoyub Əmir Xəlilin ordusuna həmlə etdi. Əmir Xəlil xar və zəlil olub Sistan tərəfə fərar etdi. Sultan Əbu-Səid bu xəbəri eşidib tam sürətlə Herat tərəfə hərəkətə gəldi və zəfər nişanlı qoşunlar Sistanı əhatəyə aldılar. Əmir Xəlili tamamilə xof bürüdü və o, səmimiyyət üzünü aləmin pənahı olan dərgaha tutdu. Sultan Əbu-Səid onun günah dəftəri üzərindən əfv yazısı çəkib ona böyük əmirlər silkində yer verdi. Amma Sistan hakimliyini Şah Yəhyaya lütf etdi.

Həmçinin bu il Cahanşah padşahın oğlu Mirzə Əbu-Yusifin elçiləri bol töhfələrlə Sultan Əbu-Səidin dərgahına gəlib, hörmət görərək Kirmana qayıtdılar.

---

[1105] *Qurani-Kərim, "Naziat" surəsi, 40-cı ayə.*

[1106] Viyarcümənd (Biyarcəmənd) – İranda, Damğanla Səbzəvar arasında yaşayış məntəqəsi.

[1107] Balqabaq (mətndə: qabaq) bayram günlərində keçirilən ox yarışları zamanı bir çubuğun üzərinə bərkidilərək hədəf kimi istifadə olunardı. Şair burada Xəlilin keçəl başını balqabağa bənzədir və onun başının bayram günü keçiriləcək ox yarışında balqabaq yerinə hədəf kimi istifadə olunacağına işarə edir *(Nəvai, şərhlər, s.606).*

Həmçinin bu əsnada Sultan Əbu-Səidin qulağına çatdı ki, darvazabanlar (darvaza gözətçiləri) şəhərə taxıl və meyvə gətirən hər kəsdən zor və güc yolu ilə bir miqdar və ya bir məbləğ alırlar. O həzrət buyurdu car çəksinlər ki, "heç bir yaradılmış, darvazabanlıq vəzifəsindən istifadə edib heç bir kəsdən heç nə almasın və əgər alarsa, əzaba və cəzaya məruz qalsın!"

Həmin zaman rəiyyət ərz etdi ki, "bir dəstə avaralar və alçaqlar gecələr səhərə kimi küçələrdə və məhəllələrdə gəzirlər". Ona görə də, əmrə uyğun olaraq, onların bir dəstəsi qətlə yetirildi.

Həmçinin bu il Qəlmaq məmləkətinin elçiləri Dəşti-Qıpçaqdan gəlib Sultan Əbu-Səidin ayağını öpmək şərəfinə nail oldular.

Müzəffər bayraqlı hökmdar Əbülqazi Sultan Hüseyn mirzə Amudərya çayından keçdikdə Mirşahın və Sultan Əlinin adamları o yüksək məqamlı padşahın dərgahına tələsdilər və mülazimlik kəmərini bellərinə bağladılar. O zaman zəfər nişanlı qoşunun qaravulları Xarəzm valisi Mustafa xanın qardaşı Pirbudaq xanın mülazimlərindən on nəfəri tutub gətirdilər. Sultan Hüseyn onları buraxıb Pirbudaq xana məhəbbətamiz kəlmələrlə xəbər göndərdi. Çoxlu söz-söhbətdən (danışıqlardan) sonra o, öz bacısını Pirbudaq xana ərə verdi. Ona görə də qardaşlar arasında nifaq tozu qalxdı. Sultan Hüseyn mirzə, Pirbudaq xanla birləşdi. Mustafa xan xeyli savaşdan sonra Vəzir şəhərinə[1108] sığındı. Sultan Hüseyn mirzə və Pirbudaq xan şəhəri bir mərkəz kimi əhatəyə aldılar. Təqribən qırx gün aləmi yandıran qoşunlar qaragün müxaliflərə qarşı vuruşdular və həmin günlərdə iyirmi beş kərə döyüş baş verdi. Axırda Mustafa xan özünün məxsusi (xassə) şahinini Sultan Hüseyn mirzənin yanına göndərdi. Ona görə də onlar köç etdilər.

### 865-Cİ İLDƏ (17.10.1460 – 05.10.1461) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA

Bu il Mavəraünnəhr tərəfdən xəbər gəldi ki, Mirzə Əbdüllətifin oğlu Mirzə Məhəmməd Cuki müxaliflik bayrağını qaldırıb o diyara soyğun və qarət atəşi salmışdır. Sultan Əbu-Səid bu hadisədən xəbər tutduqda, cəmadiyüləvvəlin 20-də (03.03.1461) Mavəraünnəhr tərəfə yola düşdü. Mirzə Məhəmməd Cuki o həzrətin gəlişini eşitdikdə Şahruxiyyə qalasına sığındı. O yerdə Xocənd çayı adlanan Seyhun çayı (Sırdərya) o qalanın ətrafına dolanır və qalanın üç tərəfini əhatə edir. Çayın olmadığı bir tərəfdə isə böyük və dərin su çuxurlarının və xəndəklərinin olması səbəbindən oradan keçmək olduqca çətindir.

Sultan Əbu-Səid sayı qarışqadan və çəyirtkədən daha artıq olan qoşunlarla Bəlx şəhərinə çatdı və böyükləri ziyarət etməklə şərəfləndi. O diyardan köçə-köçə Şahruxiyyəyə yönələrək mühasirə və müharibə bayrağını qaldırdı. Az qaldı ki, qala fəth olunsun. Lakin o əsnada Xorasan tərəfdən qasidlər gəlib ərz etdilər ki, Sultan Hüseyn mirzə Xarəzm çölündən Astarabadın üzərinə gəlib o diyarı ələ keçirmişdir. Ona görə də Sultan Əbu-Səid, Əmir Seyid Əsil Ərğunu[1109] və Seyid Muradı Xorasan tərəfə yolladı ki, o diyarın hüdudunu mühafizə etsinlər.

Müzəffər bayraqlı qalib hökmdar Əbülqazi Sultan Hüseyn mirzə Sultan Əbu-Səidin getməsi xəbərini eşitdikdə Əvaq mövqeyindən Astarabad vilayəti tərəfə hərəkət etdi. Öz atası Sultan Əbu-Səid tərəfindən o məmləkətin valisi olan Mirzə Sultan Mahmud qeyri-məhdud bir qoşunla onun qarşısına çıxdı. İki tərəf arasında böyük bir savaş oldu. Fəth və zəfər yeli o ədalətli hökmdarın (Sultan Hüseynin) bayrağının pərçiminə əsdi. Mirzə Sultan Mahmud, Əbdüləli Tərxanla birlikdə Xorasan tərəfə qaçdı. Onun əmirlərindən Həsən Candarın oğlu Əmir Şeyx Hacı və Allahverdi bəy bir sıra sərdarlarla birlikdə öldürüldülər. O həzrət çoxsaylı ordu ilə şaban [ayının] (12.05-09.06.1461) ortasında darülfəth (fəth məkanı) Astarabada daxil oldu. Bir neçə gün sonra səadətli hökmdar Herat üzərinə hərəkət etdi.

Bu xəbər Sultan Əbu-Səidin əmirlərinin qulağına çatdıqda, Nişapur hüdudunda olan Əmir Əsil Ərğun və Əmir Seyid Murad özlərini Herata saldılar və mükəmməl bir şəkildə qala müdafiəsi ləvazimatını tərtib etdilər. O behişt görkəmli şəhərin daruğası olan Əmir Binəzir, Məlik darvazasını qorumağı öhdəsinə götürdü. Əmir Əbdülnəsir İraq darvazasını mühafizə etdi. Firuzabad darvazasını Əmir Əhməd Hacı möhkəmləndirdi. Qıpçaq darvazasının qorunması Əmir Əhmədyara tapşırıldı. Xoş darvazasını Əmir Sultan Hüseyn

---

[1108] Vəzir şəhəri – Türkmənistanın şimalında, Dəryalıq çayı sahilində yerləşmiş orta əsr şəhəri. Hal-hazırda onun yerində Div-kəsən qəsəbəsi mövcuddur *(О.Экаев. Туркменистан и туркмены, с.14).*

[1109] Nüsxələrdə "Əmir Xəlil" qeyd edilsə də, Ə.Nəvai (s.608) "Mətləüs-səədeyn"ə əsaslanaraq "Əmir Seyid Əsil Ərğun" yazmışdır.

Ərhəngi[1110] tutdu. Seyid Əsil Ərğun və Seyid Murad zəfərə öyrəşmiş bir dəstə bahadırlarla ehtiyatda qaldılar ki, hansı tərəfdə çətinlik olarsa, oraya yönəlsinlər.

Sultan Hüseyn mirzə Sərəxs qalasını fəth etdikdən sonra düşənbə günü, zilqədə [ayının] 24-də (31.08.1461) çoxlu qoşunlarla Kələ-Muxtar dağı yolundan gəlib öz səadətli qədəmlərinin izzəti ilə Zağan bağının cənnət bağına həsəd bəxş etməsinə səbəb oldu. O, elə təsəvvür etdi ki, şəhər camaatı darvazaları açacaq və onun hüzuruna tələsəcəkdir. Buna görə də bir neçə gün döyüş atəşini alovlandırmağı təxirə saldı. Bir gün Sultan Hüseyn mirzə öz xas xidmətçilərindən [ibarət] bir dəstə ilə, qoşunsuz və ordusuz halda xoş yerişli atına minib, hamama getmək üçün Zağan bağı yolundan yavaş-yavaş yola çıxdı. Heratlılar xəbərdar oldular və o dövlət qülləsi şahbazını ovlamaq fikrinə düşdülər. Ona görə də bir dəstə piyadalar və süvarilər döyüş əzmi ilə qala darvazalarından çıxdılar. Sultan Hüseyn mirzə onların hərəkətindən xəbərdar olub, öz nəfis vücudu ilə o saysız qoşuna həmlə edərək onları tar-mar etdi.

O həzrət bütün igidləri ilə Zağan bağından köç edib Kəhdəstan çəməninə tələsdi və cövşən geymiş əsgərləri ilə iki-üç dəfə Xoş darvazasına qədər gəlib vuruşdu. Amma ona fəthin üzünü görmək nəsib olmadı. Mühasirənin müddəti iyirmi günə çatdıqda xəbər gəldi ki, Sultan Əbu-Səid mirzə Məhəmməd Cuki ilə sülh bağlayıb köçə-köçə gəlməkdədir. Ona görə də Sultan Hüseyn mirzə Mürğab çayı tərəfə hərəkət etdi. Yenə xəbər çatdı ki, Əmir Seyid Məzid Ərğun və Xəlil Hindukə qəhr meşəsinin aslanlarından və Mavəraünnəhr igidlərindən [ibarət] çoxsaylı bir dəstə ilə Muri mövqeyinə gəlmişlər və Sultan Əbu-Səid də arxadan gəlib yetişməkdədir. Ona görə də Sultan Hüseyn mirzə sərsəm və heyran qalıb hiddətli aslanın və şiddətli bəbirin həmləsindən qaçan cüyür kimi aradan çıxdı, sayı qarışqalar qədər olan qoşunun qorxusundan ilan kimi deşik axtardı, gümüş simalı qılıncın şövkətindən civə kimi titrədi və o qədər sürətli qaçdı ki, öz kölgəsini ötüb keçirdi. Əli Şeyx Teymur bir dəstə əsgərlə ondan üz döndərib Sultan Əbu-Səidin qoşununa qoşuldu. Sultan Əbu-Səid şərəfli qədəmlərinin uğuru ilə Astarabad şəhərinin gülşənini Gülüstani-İrəmi qısqandıracaq hala gətirdi. Əhvalının səhifəsi üzərində dəfələrlə xəyanət və nifaq əlamətləri görünmüş və bəlli olmuş Əmir Xəlil Hindukə öz övladları ilə birlikdə ölümlə cəzalandırıldı (yasağa çatdı).

Bu il Sultan Əbu-Səid cəlair qövmünü qətlə yetirdi. Onlar uzun zamandan bəri o vilayətdə yurd və məskən salmışdılar və o mülkün tamamını öz mülkləri bilirdilər. Onlar çoxlu mal-qara və davarlara, saysız sürülərə və nökər-naibə malik idilər. Onların xəyal aynasında belə bir təsəvvür yaranmışdı ki, onların istəmədikləri heç bir hakim o məmləkətdə qala bilməz və daim qan tökməyi və fitnə salmağı özlərinə şüar etmişdilər. Qarət və tarac etməkdən başqa bir işlə məşğul olmazdılar. Təbiətən Sultan Hüseyn mirzənin tərəfdarı idilər, gizli və aşkar şəkildə ona meyil edir və məhəbbət bəsləyirdilər. Sultan Əbu-Səid istədi ki, gözəl bir tədbirlə onların dikbaşlarının boyunlarını təqdir zəncirinə bağlasın və məmləkətin ətrafını o camaatın əziyyətindən xilas etsin. O, təvaçı əmirlərinə buyurdu:

- Cəlair elinə və ulusuna müjdə verin ki, onlar üçün o vilayətdə ülufə və soyurğal təyin etmişəm.

Bəxşilər[1111] cəlair camaatının sayını və fikrini öyrənib bir neçə gün onlarla söhbət etdilər. Onları tutmaq üçün adamlar təyin etdilər. Cəlair qövmünün Güləfşana gəlməsi qərarlaşdırılan gün onlar (təyin edilən adamlar) oraya gəldilər; qərara alındığı kimi, onların (cəlair qövmünün) hamısını tutub, meydanda başlarını vuraraq onların başlarından minarələr düzəldilər və digər qorxmazların canına od saldılar.

Cahangir hökmdarın mübarək könlü Cürcanın nəzarət altına alınması ilə rahatlıq tapdıqdan sonra yenə də o diyarın hakimliyini möhtərəm oğlu Sultan Mahmuda lütf edib dövlətin paytaxtına tələsdi.

Sultan Hüseyn mirzə Əvaq ətrafında yerləşdi. Bir neçə gün sonra o, Ceyhun kənarına yönəldi. O zaman xəbər çatdı ki, Osman Qünqürat, Mustafa xanın fərmanına qarşı çıxaraq müxaliflik iddiası edir. Ona görə də Sultan Hüseyn mirzə bir dəstə bahadırlarla birlikdə müxaliflərlə savaşmaq üçün hərəkət bayrağını qaldırdı. Onlar zəfər nişanlı qoşunların xofundan Vəzir şəhərinə sığındılar. Ertəsi gün Osman Qünqürat süvarilərdən və piyadalardan [ibarət] bir dəstə ilə səhraya çıxdı və döyüş səfi tərtib etdi. Döyüşdən və savaşdan sonra Məhəmməd Əli, Dövlət Xoca Özbəyin sərkərdəlik etdiyi sol cinahın arxasına keçib, onu əsir alaraq qalaya apardı. Amma digər müxaliflər Sultan Hüseyn mirzənin həmləsinə tab gətirməyib qalaya fərar etdilər.

---

[1110] Nuruosmaniyyə nüsxəsi: "Həsən Sərhəngi".
[1111] Bəxşilər – burada katiblər mənasındadır (bax: *V.Piriyev. Azərbaycan XIII-XIV əsrlərdə, s.324-325*).

Qalibiyyətli ordu o məğrur güruhu təqib edib şəhəri ələ keçirdi. Osman Qünqürat və Mustafa xanın bütün mülazimləri qaçış yolunu tutdular.

Bir neçə gün sonra Osman Qünqürat dərgaha gəlib Fəridun kimi şan-şövkətli hökmdar tərəfindən qəbul edildi. Vəzir şəhərinin əhalisi taxt-tac sahibinə belə ərz etdi:

- Bizim vətənimiz Xarəzm şəhəridir. Mustafa xan bizi bu vilayətə gətirmişdir. Ümid edirik ki, bu biçarələri öz həqiqi vətənlərinə göndərəcəksiniz.

Ona görə də Sultan Hüseyn mirzə Xarəzmə yönəldi və qısa zamanda Cürcaniyyəni abadlaşdırıb, o şəhərin idarəçiliyinin yüyənini Seyid Zeynalabidin Xivəqinin ixtiyar əlinə verərək Əvaqa yola düşdü. Elə həmin zaman Xivəq sakinləri Sultan Hüseyn mirzənin havadarlığı ilə Sultan Əbu-Səid tərəfindən onlara hakim təyin olunmuş Qutluq Dərvişə qarşı üsyan qaldırdılar və onun oğlunu qətlə yetirib başını dərgaha göndərdilər.

Ona görə də hökmdarın (Sultan Hüseynin) məiyyəti o tərəfə tələsib həmin şəhəri mühafizə etdi. Bir neçə gündən sonra Xarəzmə qayıdıb, yenidən hərəkət bayrağını Astarabada doğru qaldırdı. Mərv hüduduna çatdıqda məlum oldu ki, Seyid Əsiləddin Ərğun və Seyid Murad, Sultan Əbu-Səidin ordusunun çoxsaylı bir dəstəsi ilə o diyarı mühafizə edirlər. Ona görə də Sultan Hüseyn mirzə Xarəzmə döndü.

Bu il Mazandaran valisi Seyid Əbdülkərim hərəkət bayrağını axirət tərəfə qaldırdı. Oğlu Seyid Abdulla onun yerinə oturdu.

## 866-CI İLDƏ (06.10.1461 – 25.09.1462) BAŞ VERMİŞ HADİSƏLƏR

### Rum padşahı Sultan Məhəmmədin Əflaq tərəfə qoşun çəkməsi

Rum padşahı Sultan Məhəmməd Trabzona yönəldiyi zaman Əflaq hakimi Qazıqlı Voyvoda[1112] ayağını öz yolundan kənara qoyub, küfr və islam məmləkətləri arasında sərhəd olan Tuna çayından keçərək sultana məxsus yerlərdən bir çoxunu talan və qarət etdi və Sultan Məhəmmədin mötəbər qulamlarından olan sərhəd sərkərdələrindən Yunis bəylə və Həmzə bəylə vuruşub onları qətlə yetirdi.

O, son dərəcə zalım, qəddar, məkrli və sitəmkar bir kafir idi. O, həddən artıq şücaəti və cəsarəti sayəsində bütün kafir hökmdarlarından və pozğun qeysərlərdən üstün və seçkin idi. Həmin itaətsiz kafir Əflaq məmləkətindən savayı, geniş Engirüs mülkünə və Qara Boğdana[1113] da əl uzatmışdı. Onun cəza üsullarından biri bu idi ki, öz mənzilinin qarşısında altı mil ərazidə divar çəkmişdi, o sahəyə ağac və meyvə pöhrələri əvəzinə ucu yonulmuş çubuqları yerə basdırmışdı və zorla tutub əsir etdiyi düşmənlərini həmin iti uclu çubuqlara oturdurdu. Bəzilərini isə çarmıxa çəkirdi və o halda qoyurdu ki, havadakı quşlar onları yesinlər. Kimsə o çarmıxa çəkilmişləri azad etsəydi, onu həmin adamın yerinə asırdılar. O, özünün əyləncə məkanını o sahəyə baxan yerdə düzəltmişdi və deyirdi:

- Bura igidlərin istirahət yeridir. Buranın ağaclarının üzərində sərvərlərin başlarından [ibarət] çeşidli meyvələr sallanmışdır.

Xülasə, sultan Trabzon qəzavatından qayıtdıqdan sonra o ədalətsiz zalımın fikrinə və əndişəsinə qapıldı. O, cahanın tabe olduğu hökmlərini göyərçinlərin qanadlarına bağlayıb, məmləkətlərin ətrafına göndərərək Rumeli və Anadolu əsgərlərini çağırdı. Aləmin ətrafından və yan-yörəsindən onun ali kölgəsi altına elə bir qoşun toplandı ki, onun həddini-hesabını bilmək gümanın imkanı xaricində idi və heç bir mühəndisin idrak qüvvəsi onun kəmiyyətini bilə bilməzdi. Belə ki, yerin dirəkləri onun ağırlığının gücündən titrəməyə başladı. Sonra cihad niyyəti ilə darüssəltənədən çıxıb hərəkət etdi.

Nəzm

“Nücum alimlərinin müşayiəti ilə,
Elə bir tərzdə yürüşə çıxdı Rum başçısı ki,
O güruhun heybət və şiddətindən,

---

[1112] Əflaq hakimi Qazıqlı Voyvoda – Rumıniyadakı Valaxiya hakimi Vlad nəzərdə tutulur. Son dərəcə qantökən və qəddar olan bu hakimə öz həmvətənləri Drakul (şeytan) adını vermişdilər. Öz düşmənlərini türklərin “qazıq” (kazık) dedikləri iti uclu payalara keçirdiyi üçün Osmanlı türkləri ona “Qazıqlı Voyvoda” adını qoymuşdular *(Nəvai, şərhlər, s.613).* III Vlad adı ilə taxta çıxmış bu şəxs 1448, 1456-1462 və 1476-cı illərdə Valaxiya hökmdarı olmuşdur.

[1113] Qara Boğdan (və ya sadəcə Boğdan) – Moldova nəzərdə tutulur.

Düşdü ulduzların gözündən şövkət.
O asiman kimi hövsələli [sultan],
Cəsur aslan kimi ceyran sürüsünün üstünə getdi".

Qısa zamandan sonra hər diyardan çoxlu qoşun şəhər kənarında o zəfər şüarlının ordusuna qatıldı. Belə ki, Tuna çayından keçərkən onun yanında iki yüz min süvari və piyada vardı. Rum əsgərləri Əflaq məmləkətlərinin ərazisini öz çadırları ilə çəmən və gülzar sahəsinə döndərdikdə və gül-çiçək kimi rəngli bayraqlarını hər tərəfdən qaldırdıqda sultan, Evrenos bəyi axınçılar dəstəsi ilə o dovlətsiz kafirin vilayətini talan və qarət etməyə yolladı. O əsnada sultana xəbər çatdı ki, Əflaq hakimi olan o itaətsiz kafir ağacların yarpaqlarından və yağış damlalarından daha artıq bir qoşunla döyüşə və vuruşa hazırdır. Sultan da ehtiyat tədbirləri görüb ordunun səfini tərtib etdi. Sağ cinahda Ömər bəy Turxanoğlu, Əhməd bəy Evrenosoğlu, Əli bəy Mixaloğlu, Balı bəy Malqoçoğlu və b. adlı-sanlı əmirlər qərar tutdular. Sol cinahda Nüsuh bəy, Ümur bəy, Dəlioğlu və İsgəndər bəy Mixal[oğlu] bir dəstə igidlər və seçkinlərlə dayandılar. Qoşunlar bayraqlarını qaldırdılar, şeypur və nağara çaldılar.

Beyt

"Nizənin ucu gül rənginə döndü,
Şəfəq yerdən bir nizə hündür idi".

Bu əsnada belə məlum oldu ki, Boğdan hakiminin[1114] Əflaq valisi ilə ədavəti vardır. Bu səbəbdən Qazıqlı Voyvoda da min süvarini ehtiyat üçün onların qarşısında qoymuşdur. O nadan kafir, Evrenos bəyin başçılıq etdiyi axınçılar dəstəsindən xəbərdar olduqda istədi ki, dar yollarda onlara həmlə etsin və əsirləri geri alsın. Onlar sultan ordusunun qaraltısını uzaqdan gördükdə onu qarətkarlar dəstəsi hesab etdilər və bir anda hücuma keçdilər. Yanlışlıq tozu bəxti dönmüş kafirlərin yalnız zahiri görə bilən gözündən çəkildikdən və onlar onun sultan olduğunu anladıqdan sonra hamısı birdən idbar üzlərini fərar vadisinə çevirdilər. Rum ordusu cilovunu boşaldıb onların ardınca getdi və hər çöldə, hər dağda o şövkətsiz kafirləri dəstə-dəstə tutub qətlə yetirdilər. Belə ki, doqquz min bədbəxt kafirdən sadəcə min nəfəri yüz hiylə ilə canlarını oradan xilas edə bildilər. Onlar da qaçış əsnasında Evrenos bəyin axınçılarına rast gəldilər. [Axınçılar] əvvəlcə qorxub qaçsalar da, əhvalatdan agah olduqdan sonra onların ardınca gedib o dinsizlərin əksərini gedər-gəlməzə göndərdilər.

Bu hadisədən sonra ali mənşəli sultan izdihamlı qoşunla Əflaq məmləkətinin dağında və səhrasında gəzib-dolaşdı. O zaman kafirlərin ürəyi kimi zülmətli və qaranlıq, yüksək ulduzların gözü kimi zülmət yığınından tutqun olan bir gecədə Əflaq hakimi yaraqlı kafirlərdən [ibarət] bir dəstə ilə "O, bir şeyə ol deyərsə, olar"[1115] hökmündən xəbərsiz halda gecə basqını etmək üçün sultanın ordusunun ətrafına çatdı. Onlar bayraqlarını qaldırdılar, şeypur və nağara çaldılar. Sultan bildi ki, küfr və nifaq əhlinin başçısı, yəni Əflaq valisi özünü pərvanə kimi bu qaranlıq gecədə bu dövlətin işıqlı şamına vurmaq və milçək kimi özünü uğursuz bir şəkildə şanı balının kasasına atmaq istəyir. Sonra hökmdar əmr etdi ki, əsgərlər top-tüfəng zərbəsi ilə döyüş atəşini alışdırsınlar və çaşqın düşmənlərin xırmanını yandırsınlar. Həmin zülmət gecədə o arsız kafir özünü ordunun içinə saldı. Anadolu ordusu o bədbəxtlərlə həmin qaranlıq gecədə atəş saçan qılıncın və iti xəncərin dili ilə mükalimə etməyə (danışmağa) başladı.

Şeir

"Hər tərəfdən qan tökən xəncərlər,
Qanlı idi və kafir ürəklərin qəmzəsi kimi iti idi.
Sinəsi yaralı, aslan kimi igidlərin oxu,
Dikbaşların qətli üzündən qanda oturmuşdu".

Beyt

"Hansı başa qılınc dəydisə,
Onun kəlləsi iki yerə bölündü".

---

[1114] Boğdan hakimi – 1457-1504-cü illərdə hakimiyyətdə olmuş Moldova hökmdarı Böyük Stefan (Ştefan Çel Mare) nəzərdə tutulur.

[1115] *Qurani-Kərim, "Bəqərə" surəsi, 117-ci ayə və s.*

Müzəffər əsgərlərin çadırlarının kəndiri qayış kimi o zəlalətli kafirlərin ayağına dolaşdı və onlar həlak torpağı üzərinə düşdülər. O idbar üzüqaralar və o zərərli qarabəxt kafirlər ox yağışı zərbəsindən o qaranlıq gecədə məğlub olub [döyüşdən] üz çevirdilər. Onlar müharibə əhlinin zərbələrindən tamamilə xali olan ordubazar yolu ilə fərar etməyə macal tapdılar. O qəddar qoşun məkr və hiylə vasitəsilə ordubazardan keçdikdən sonra Rumeli qoşunlarına rast gəldi. Onlar da top, tüfəng, çubuq və daş zərbəsi ilə kafirləri həlak torpağı üzərinə saldılar. Belə ki, o nakəsin yanında olan on min nəfərdən biri də canını salamatlıqla qurtara bilmədi.

Nəzm

“Heç kəs canını salamatlıqla meydandan çıxara bilmədi,
Və əgər çıxardısa da, kin yarasından canını qurtara bilmədi.
Yıxıldılar igidlər yüz dərd və dağla,
Boşaltdılar qürur yelini öz beyinlərindən”.

O inadkar müşriklərin[1116] başçısı, şeytanın və Yezidin qardaşı öz başını min cür məkr və hiylə ilə o ölüm burulğanından bir kənara çıxara bildi. O, sultanın xofundan, kamandan çıxmış ox kimi [oradan] uzaqlaşdı və səf yaran hökmdarın qılıncının qorxusundan, qartaldan qaçan göyərçin kimi aradan çıxdı. Cəngəlliyi və dərəni bağ-bostan bildi, dəvətikanının iynələrini və tikanlarını gül və rehyan saydı. Sanki o lənətəgəlmiş savaş meydanı bahadırlarının qorxusundan yer üzünü bir gündə qət edəcəkdi. O, sultanın qılıncının heybətindən döyüş meydanından göydəki aya qaçmağa yol axtarırdı və canının qorxusundan köhnə düşməni olan Engirüs kralının yanına sığınmalı oldu. Kral dərhal onu həbs etdi. Rum ordusu bütün Əflaq məmləkətini ələ keçirdi. Adlı-sanlı sultan o diyarın idarəçiliyini o qəhr olmuş kafirin Radul Voyvoda adlı qardaşına tapşırdı. Çünki o, illərlə sultanın xidmətində idi.

Sultan, Əflaq qəzavatından döndükdən sonra hərəkət bayrağını ən məşhur yunan adası olan Midilliyə[1117] doğru qaldırdı. Həmin adanın uzunu və eni üç günlük yoldur. Dördüncü və beşinci iqlimlər arasındadır. Ora çox geniş və açıqlıq bir ölkədir. Orada çoxlu möhkəm qalalar var və havası nə soyuqdur, nə istidir. Orada həmişə bahardır.

Şeir

“Temmuzda[1118] orada dağçiçəyi yetişir,
Qışda orada bahar yelləri əsir.
Torpağı qızıl suyuna boyanmış,
Elə bil ki, zəfəran əkilmişdir”[1119].

Uzun sözün qısası, sultanın dağ görkəmli, bulud rəftarlı, hilal təsvirli və fələk miqdarlı gəmiləri var idi.

Nəzm

“Yollarda tək-tənha bir yolçu,
Hansı ki, bir xalqı təhlükədən qurtarar.
Tamamilə yeməkdən və yatmaqdan əl çəkmiş,
Səribdir gecə-gündüz su üstünə səccadə.
Can ilə çalışır insanların işindən ötrü,
Çiyni və başı ilə çəkir insanların yükünü”.

Din sultanı belə bir güclü ordu ilə Anadolu əmirlərini yanına alıb, Bursa və Saruxan eli[1120] yolundan keçərək Ayazmit[1121] səhrasında asimana bənzər çadır qurdurdu. Gəmilər də Midilli adası kənarında lövbər

---

[1116] Müşrik – Allaha şərik qoşan, kafir.

[1117] Midilli – Egey dənizinin şimal-şərqində yerləşən və hazırda Yunanıstana aid olan bir ada. Yunanlar tərəfindən Lesbos adlandırılır.

[1118] İyulda.

[1119] Bu şeir Nizami Gəncəvinin “İsgəndərnamə” poemasındakı Bərdənin tərifi haqqında hissədən götürülmüşdür.

[1120] Saruxan eli – XIII əsrin sonlarından XV əsrin əvvəllərinə qədər Türkiyənin Manisa bölgəsində hökm sürən türk bəyliyi (*F.Emecen, M.B.Tanman. Saruhanoğulları // TDVİA, cilt: 36, yıl: 2009, s.170-174).*

[1121] Ayazmit – yəqin ki, İzmit nəzərdə tutulmuşdur. Amma burada bir yanlışlıq vardır. Çünki Midillinin qarşısındakı sahilə (yəni Saruxana) çatmaq üçün İzmit Bursadan, Bursa da Saruxandan daha öncə qət edilməlidir *(Nəvai, şərhlər, s.619).*

saldılar. Qalanı qurudan və dənizdən mühasirəyə aldılar. Ürək deşən gözəllərin qəmzəsinin qaragün aşıqlərin sinəsinə endirdiyi zərbə kimi, Midilli qalasının ətrafını və yan-yörəsini top-tüfəng atəşi ilə deşik-deşik etdilər.

Beyt

“Tüfəng aşiq kimi qara bəxtdən,
Cahanı qara etdi ah tüstüsündən”.

O müharibə meydanında hər an və o vuruşma sahəsində hər dəm qala əhlinin dilindən və hər bürcün və divarın deşiklərinin ağzından “Ola bilsin ki, Allah bir zəfər gətirsin və öz tərəfindən bir iş qursun”[1122] deyə rica və ümid naləsi yerin və göyün qulağına çatırdı.

Xülasə, Rum ordusu birdən qala üzərinə hücuma keçib qalanın içinə daxil oldu və onların arvad-uşaqlarını əsir etdi. Fəthdən sonra əsirləri üç qismə ayırdılar: Birincisi onlar idi ki, Firəng ölkəsindən məmləkəti əldə saxlamaq və qəhr olmuş Təkfura kömək etmək üçün gəlmişdilər. Onların hər biri igidlik tövründə və kafirlik əqidəsində özünü sərvər və sərdar hesab edirdi. Həmin fəth zamanı ədalət və əyalət sahibləri bu qismdən olanların bədənlərini iki yerə parçalayaraq ortadan tən yarı böldülər. Qiyamət gününün vəziyyətinə uyğun olaraq, “Rəblərinin hüzurunda başlarını aşağı əymiş”[1123] şəkildə o rədd edilmiş güruhun başlarını ayaqlarının yanına atdılar.

Beyt

“Hər kim bir gün bəndəlik boyunduruğundan boyun qaçırırsa,
Dövran onun boynuna ip bağlayıb zindana aparır”.

Kəsbkarlıq və sənət əhli olan digər güruha məmləkətin abadlığı və firavanlığı üçün başları, canları və ailələri ilə birlikdə aman verildi. Onların malları və əmlakları üzərinə bir qədər cizyə[1124] və xərac təyin edilərək onların boynuna bir məbləğ [vergi] qoyuldu. Onların uşaqları hələ əsli fitrətdən və əzəli qabiliyyətdən uzaq düşmədiklərinə və ayna misallı çöhrələrində iman nuru göründüyünə görə onları islam əhlinə xidmət üçün seçdilər. Bütün ay üzlü hurilər və qılmanlar kölə silsiləsinə daxil edildilər.

O diyarın qəriblərindən və ya sərvət və bacarıq sahiblərindən ibarət olan digər qismini isə fidyə və qanbahası (xunbaha) malını (vergisini) tədarük etmək üçün həbs edib zəncirə vurdular. Onlardan fidyə vergisi aldıqdan sonra hamısını həbsdən və dustaqlıqdan azad etdilər.

Oranın Təkfur hakiminin paytaxtı olan Midilli qalası[1125] rumilərin əlinə keçdikdən sonra o diyarın təbəələrinin əlindəki digər yerlər və qalalar təbəəlik yolu və məiyyət qanunu əsasında təhvil-təslim vasitəsilə ələ keçirildi. Qanun və əmin-amanlıq zərurəti ilə hər yerə qazılar, hakimlər və mühafizlər təyin olundu. Qəsəbələri və kəndləri ədalət və insaf memarlığı ilə islam torpağına çevirdilər. Rahiblərin və keşişlərin monastrları və kilsələri əvəzində məscidlər, camelər, tovhid və iman əhlinin məbədləri asimanın zirvəsinə yüksəldi, Məhəmmədi azanın avazı ucaldı. Bir çoxlarını iman nuru ilə doğru yola yönəltdilər, onları islam cəmiyyətinə daxil etdilər və onların məskənlərini də islama tabe etdilər.

**Xorasan diyarında baş vermiş hadisələr haqqında söhbət**

Sultan Əbu-Səid Cürcanın zəbtindən sonra hərəkət bayrağını Xorasan tərəfə qaldırdı. Ədalət şüarlı hökmdar Tanrının köməyi ilə Kusuyəyə[1126] çatdıqda o diyarın rəiyyəti məmurların onlardan çoxlu qızıl aldıqlarından şikayət etdilər. Hökmdar fərman verdi ki, rəiyyətdən artıq alınmış hər şey xəzinədən geri verilsin. O cahandarlıq binasının banisi rəbiüssani [ayının] 23-də (25.01.1462) səadət və xoşbəxtlik halında cah-calalla Sefid bağına daxil oldu.

O əsnada xəbərçilər ərz etdilər ki, Xoca Müizzəddin çoxlu zülm etmişdir və Şeyx Əhməd Sərraf da borc bəhanəsi ilə camaatdan və tacirlərdən çoxlu qızıl almışdır. Elə ki bu xəbər alinəsəb hökmdara çatdı, ali hökm verildi ki, onları digər qorxmazlara ibrət olacaq bir şəkildə həlak etsinlər. Məlik darvazasında Şeyx Əhmədin dərisini soydular. Xoca Müizzəddini isə qaynar qazana atdılar və orada qaynayıb həlak oldu. Alə-

[1122] *Qurani-Kərim, “Maidə” surəsi, 52-ci ayə.*
[1123] *Qurani-Kərim, “Səcdə” surəsi, 12-ci ayə.*
[1124] Cizyə – orta əsrlərdə müsəlman ölkələrində qeyri-müsəlman əhalidən toplanan vergi.
[1125] Həmin zaman Midilli adasında genuyalı Nikolo hakimiyyətdə idi *(Nəvai, şərhlər, s.621).*
[1126] Kusuyə – Əfqanıstanın şimal-qərbində, Hərirud çayı yaxınlığında yer adıdır.

min müti olduğu bir fərman verildi ki, bundan sonra Heratda və bölgələrdə (bölükat) bəratsız qızıl toplanmasın. Bu fərmanı daş üstündə nəqş edib Heratın cümə məscidinin qapısında münasib bir yerə taxdılar.

Cəmadiyüləvvəlin 27-də (27.02.1462) cahanın pənahı olan padşah çoxlu ordu ilə Turana yollandı. Rəcəb [ayının] 9-da (09.04.1462) [dünyanın insanla] məskun dörddə bir hissəsinin hökmdarı Ceyhundan keçdi. Ayın axırında hökmdar cah-calalla Səmərqəndə çatdı. Şanlı ordu dağı və səhranı qət etdikdən sonra Şahruxiyyə qalası ətrafında dayandı. Mirzə Məhəmməd Cuki qalanı son dərəcə möhkəmlətmişdi. Ona görə də səadətli hökmdar bir dəstəni qalanın ətəyində qoyub Səmərqənd tərəfə döndü.

**Ölümlər**

Şeyx Azəri İsfərayini, Şahrux padşah zamanında məliküşşüəra idi. Ömrünün axırında Hind diyarına getdi. Hind padşahı Sultan Əhməd Gülbərgə[1127] ona əlli min dinar versə də, qəbul etmədi. Baysunqurun oğlu Sultan Məhəmməd İraqa gedərkən şeyxin gəldiyini gördü. O, şeyxə bir kisə qızıl verdi. O, qəbul etmədi. Mövlana Mücahid Hindi o qızıldan bir ovuc götürdü və dedi:

- Ey şeyx! Bu malı sən zorla özünə haram etmişsən və onu Allah-taala mənə halal etmişdir.

Bu il Şeyx Azəri hərəkət bayrağını axirət tərəfə qaldırdı. “Əcaibüd-dünya” (“Dünyanın qəribəlikləri”) kitabı, “Cəvahirül-əşar” (“Şeirlərin cövhərləri”), “Hüsniyyət” (“Gözəllik”) və “Divani-əşar” (“Şeirlər divanı”) onun mübarək qələminin məhsullarındandır. Onun vəfatı tarixi barədə demişlər:

Nəzm

“Əfsus ki, zəmanənin şeyxi Azərinin,
Həyatının çırağı işıqsız oldu.
O, şeirdə İkinci Xosrov idi[1128],
Buna görə də vəfatının tarixi oldu “Xosrov”[1129].

Həmçinin bu il Mövlana Tuti Turşizi bədən qəfəsini sındırıb cənnət bağına uçdu. Əmir Əlişir bu hadisə haqqında deyir:

Şeir

“Zamanın fəsahətlisi Tuti elə bir şair idi ki,
Bəkarətli mənalar ona gəlin olmuşdu.
O, tuti kimi getdi və bu, təəccüblü bir hadisə oldu ki,
Onun vəfatına “xoruz” tarix oldu”[1130].

## 867-Cİ İLDƏ (26.09.1462 – 14.09.1463) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Rum padşahı Sultan Məhəmmədin Bosna məmləkətinə qoşun çəkməsi və kralın o diyarda əsir alınması

Bu yürüşə səbəb o oldu ki, tabeçilik və xidmətkarlıqda özünü sadiqlər zümrəsinə daxil etmiş Bosna kralı bu günlərdə zatından gələn nifaqın və əzəli küfrünün ucbatından başını itaət boyunduruğundan və ayağını tabeçilik yolundan kənara qoydu. O, şirk, fəsad, qiyam və inad əhlindən [ibarət] bir qövmü toplayıb, öz beynində pozğun xəyallara yol verdi. Ona görə də cahan hökmdarı hərəkət bayrağını o diyara doğru qaldırdı. Bosna vilayəti geniş bir məmləkətdir. Uca dağları və əlçatmaz zirvələri vardır. Oranın dağlarında gümüş, qızıl, laciverd, erməni gili (qırmızı gil) və s. mədənləri çoxdur. Bir tərəfdən Firəng məmləkətinə bitişikdir və digər tərəfdən Engirüs vilayətinə birləşmişdir.

Xülasə, sultan iki ay müddətində Bosna sərhədinə çatdı və Tuqçe qalasını dövrəyə aldı. Qısa zamanda o qalanı zor və güc yolu ilə fəth etdi. Gündən-günə böyüyən dövlətin qüvvəsi sayəsində çoxlu qalalar və istehkamlar ələ keçirildi.

---

[1127] Yəqin ki, burada Qucarat hökmdarı Əhməd (1411-1442) nəzərdə tutulub.
[1128] Poeziyanın ilk Xosrovu Əmir Xosrov Dehləvi (öl. 725 / 1324) sayılır *(Öztürk, şərhlər, s.410).*
[1129] “Xosrov” = 866 h.
[1130] “Xorus” = 866 h.

O əsnada xəbər çatdı ki, kral Yaitçi[1131] qalasına sığınmışdır. Ona görə də sultan vəziri-əzəm Mahmud paşanı Rum əsgərləri ilə o qalanın üzərinə sürətli yürüş etməyə göndərdi. Qalib qoşun o qalanı mühasirə etdikdə aydın oldu ki, kral oradan Kliçe[1132] qalasına getmişdir. Paşa da oradan yola düşdü. O əsnada Turxan bəyin oğlu Ömər bəy kafirlərin əsgərlərindən bir neçə nəfəri tutub paşanın yanına gətirdi. Onlardan kral barədə xəbər aldılar.

Xülasə, Rum əsgərləri sözügedən qalanı əhatə etdilər. Bir neçə gün sonra kralı müqayisəyəgəlməz bir qorxu bürüdü. O, lovğalıq pillələrindən və batil təsəvvürlərdən aşağı enib, o məmləkətin bütün qalalarının, xüsusən də sözügedən qalanın açarlarını müzəffər əsgərlərin iqtidar əlinə tapşıraraq, o diyarın əmirləri və sərdarları ilə büsatı öpmək şərəfinə nail oldu. Onlar başlarını bəndəlik xəttinə və qədəmlərini tabeçilik dairəsinə qoydular və xərac ödəmək şərtləri ilə xidmətkarlıq mərasimini yerinə yetirdilər. Onun qardaşı da çoxlu danışıqlardan sonra aləmin pənahı olan dərgaha tələsdi. Adı çəkilən vəzir qoşunla və çoxlu qənimətlərlə birlikdə hökmdarın ordugahına yönəldi. Sultan, Mahmud paşanı Xersek məmləkətini (Hersoqavina) fəth etməyə yolladı. O diyarın kralı savaşsız və döyüşsüz bütün Xersek məmləkətini təslim etdi. Sultan o ölkənin fəthindən sonra Ədirnə tərəfə qayıtdı.

**Mavəraünnəhr diyarında baş vermiş hadisələr haqqında söhbət**

Bu il Sultan Əbu-Səid Şahruxiyyə qalasına yönəldi. Qalib qoşun (çərik) müharibəyə və vuruşmaya başladı. O əsnada qala bürcü uçuldu. Əsgərlər hücum etdilər. Müxaliflər mərdliklə səy göstərib sultanın qoşununun qalanın içinə daxil olmasına imkan vermədilər və dərhal bürcü ucaltdılar. Amma qüvvələrinin azlığı üzündən taqətsiz qaldılar. Sultan Əbu-Səid aydınlaşdırdı ki, ordudan qalaya taxıl aparırlar. Amma bunun necə baş verdiyi məlum olmadı. Əmir Şücaəddin Şir Hacı, Mirzə Məhəmməd Cukinin tanıdığı bir nökəri qaçırdı. O şəxs qalaya getdi. Şahzadə onun gəlişinin səbəbini soruşdu. O cavab verdi ki, "Əmir Şir Hacı mənə bir az mal təhvil vermişdi və indi onun qalanını gətirmişəm; ona görə də qaçıb yanınıza gəlmişəm". Şahzadə ona ehtiram göstərdi. Bir neçə gün sonra o, xəbəri aydınlaşdırıb sultanın hüzuruna gəldi və məruzə etdi ki, "ordubazardan bir şəxs şəhərə taxıl aparır". Sultan buyurdu ki, o şəxsi tutub qalanın qarşısında assınlar. Taxılın azlığı ucbatından Mirzə Məhəmməd Cuki qalanı təslim edib sultanın hüzuruna gəldi və o həzrətin fərmanı ilə İxtiyarəddin qalasında məhbus edildi.

Həmçinin bu il Sultan Əbu-Səid Səmərqəndin və Buxaranın tamğa [vergisini] bağışladı.

**Cahanşah padşahın Şiraz tərəfə qoşun çəkməsi və Pirbudaqla sülh bağlaması haqqında söhbət**

Bu il Mirzə Pirbudaq müxaliflik izhar edib, Neyriz[1133] hüdudundan Şulistan sərhədinə qədər layiq bildiyi hər yerdə qalalar düzəldərək darvazalar qoydurdu. Ona görə də dosta nəvaziş göstərən və düşməni məhv edən padşah hərəkət bayrağını Şiraza doğru qaldırdı.

Yəzdxas ətrafı müzəffər əsgərlərin dayanacaq yeri olduqda qala kutvalları ərz etdilər ki, "padşah keçib getsin və biz qalanı onun buyurduğu adama təslim edək". Ona görə də türkman hökmdarı köç edib Dəhnəyə qədər getdi. Yolun bağlı olduğu müəyyənləşdikdə, Əbərquh və Bəvvanat[1134] yolundan Şiraza yönəldi. İraq xəzinələrinin toplandığı Tarom qalasından dörd min tümən gətirib əmirlərə borc verdi. Qəsri-zər ətrafında Cahanşah padşahın qaravulları Mirzə Pirbudağın adamlarından bir neçə nəfəri tutub Cahanşah padşahın dərgahına gətirdilər.

Bu xəbər Mirzə Pirbudağa çatdıqda Məhəmməd Əlişəkəri, Rüstəm Tərxanın oğlu Tərxanı və Şadi bəyi təqribən min beş yüz nəfərlə birlikdə savaşa göndərdi. Cahanşah padşah isə Məhəmmədi mirzəni, Əbülfəth bəy Cagirlünü, Əmir Şahəlini və Qasım Pərvanəçini beş min süvari ilə [onların] qarşısına göndərdi. Bəhram kimi intiqamçı bahadırlar ordugahın beş fərsəxliyində bir-birilərinə çatdılar. Böyük bir savaş baş verdi. Tərxan canının qorxusundan qaçdı. Məhəmməd Əlişəkər və Şadi bəy təqribən üç yüz nəfərlə birlikdə əsir

[1131] Yaitsa.
[1132] Avropa mənbələrinə görə, Klioutç. Bundan öncə Osmanlılar Bosniyanın Sitmitsa, Mitrovitsa, Sienitsa və Bobovats qalalarını fəth etmişdilər *(Nəvai, şərhlər, s.626).*
[1133] Neyriz – İranın Fars vilayətinin şərqində şəhristan.
[1134] Bəvvanat – Şirazdan 240 km. şimal-şərqdə, Fars vilayətində bir şəhristandır.

alındılar. Məhəmməd Əlişəkərlə Şadi bəyə Əmir Əlişəkərin xatirinə aman verdilər və onlara and içdirib Mirzə Pirbudağın yanına göndərdilər. Digər adamların isə məşəl altında boynunu vurdular.

O əsnada Şadi bəyin oğlu İbrahim, Mirzə Pirbudaqdan üz döndərib Cahanşah padşahın hüzuruna gəldi. Bu xəbər Mirzə Pirbudağa çatdıqda fikir və əndişə ordusu onun beynini istila etdi. O, elçi göndərib xəbər verdi ki, "izdihamlı və qaniçən əsgərlərin yürüşü ucbatından abad İraq və Fars vilayətlərinin xaraba qalmaması və günahsızların qanının tökülməməsi üçün biz bu işin hər iki tərəfin bəyənəcəyi və hər iki dəstənin rahatlığını təmin edəcək bir şəkildə yoluna qoyulmasını istəyirik". Ona görə də Mirzə Pirbudağın anası və Cahanşahın möhtərəm hərəmi olan Xatuncan bəyim Şiraza gedib, asi oğluna nəsihət verərək onu Bağdad tərəfə yolladı.

Cahanşah padşah səadətli tale və uğurlu bəxtlə, işləri yoluna qoyan bir zəmanənin və doğru yol göstərən bir ulduzun işarəsi ilə şəhərə yeridi və dövlətin mənşəyi, səadətin başlanğıcı olan Şirazın ərazisini öz mübarək qədəmlərinin uğuru ilə bəzədi. Padşahın qüdrətli dövlətinin və gündən-günə artan uğurunun parlaqlığı ilə haqq öz mərkəzində qərar tutdu. Əsgərlər asudə oldular və rəiyyət əmin-amanlıq beşiyində yatdı. [Cahanşah] o diyarın idarəçiliyini öz səadətli oğlu Mirzə Əbu-Yusifə tapşırdı, Kazerun[1135] əyalətini və Sərdsiratı[1136] Məhəmmədi mirzəyə lütf etdi, Kirmanı və Bəvvanatı Əbülqasım mirzəyə bağışladı və digər diyarları Şahəli bəy, Şahsüvar və Lələ Səfərşah kimi adlı-sanlı əmirlərə verdi. İsfahan vilayətini də Məhəmmədi mirzəyə aid etdi.

Bu əsnada qələbə ayəli bayraqlar İsfahana dönərək Qum şəhərində qışlaq etdi. Şahruxiyyə qalası ətəyində [onun göndərdiyi] bir qasid Sultan Əbu-Səidin hüzuruna gələrək ədalətli və insaflı padşahın məhəbbətini və dostluğunu izhar etdi.

## 868-Cİ İLDƏ (15.09.1463 – 02.09.1464) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Xəlil Təvaçı, Həsən padşahın göstərişi ilə Heytəmin[1137] mühasirəsi ilə məşğul idi. O, kürdlərdən iki yüz nəfəri tutub qətlə yetirdi. Baharda şəhəri, payızda isə qalanı fəth etdi. Xələfin[1138] qatilləri olan Məlik Zeynalabidini və Məlik Əyyubu cəzalandırdı (edam etdi). Qış gəldikdə Həsən padşah qışlağa getdi. Cahanşah padşah da Qumda qışladı.

Bahar zamanı Cahanşah padşah duxarlu [tayfasından] Bayburd qalasını tələb etdi. Onlar Həsən padşahın qorxusundan imtina etdilər və Həsən padşaha ərz etdilər ki, "qalanı dərgahınızın bəndələrinə təhvil verəcəyik". Cahanşah padşah qala əhlinin ona qarşı inad və istibdad məqamında və Həsən padşaha itaət və tabeçilik mövqeyində olduğunu bildikdə bir məktub (nişan) göndərdi ki, "biz Bayburd qalasını qardaş saydığımız o cənaba veririk". Sonra qalanı dərgahın bəndələrinə təslim etdilər.

Həmçinin bu fəsildə Həsənəli mirzə ərəb diyarından daimi dövlətə qədəm qoydu və Həsən padşahın qayğıkeşliyinə sığındı. Neçə gün hüsn-rəğbət altında yaşadı, söhbət və işrətlə qəriblik kədərini dəf etdi və əyyamın sıxıntılarını aradan qaldırdı. Sonra atasına xidmət havası ilə İraq tərəfə meyil etdi və Əlikürd mövqeyinə çatdıqda irəli gedə bilmədi. Onu bürümüş qorxu ucbatından yenidən Həsən padşahın dərgahına qayıtdı və fikirlərin hücumu səbəbindən xatiri pərişan oldu. Sonra yenə də atasının hüzuruna getmək istədi. Həmin yerə çatdıqda, atası tərəfindən ona doğru yürüş dəstəsinin yola çıxdığına dair xəbərlər ağızdan-ağıza, dildən-dilə keçdi. Yenə geri döndü və əvvəlki qaydada hörmət və ehtiram gördü. Axırda onun namazı tərk etmək, qadınlara əl uzatmaq, cənabət qüslündən vaz keçmək və s. kimi qəbahətli əməlləri Həsən padşaha aydın olduğu zaman onu öz yanından qovdu və o, Bağdada getdi. Pirbudaq[1139] ona hörmət göstərib qayğıkeşlik və ehtiram qapılarını onun üzünə açdı və xidmətkarlıq vəzifəsi ilə məşğul oldu.

Bu qış Cahanşah padşah Savədə qışlaq etdi. Bahar fəslində Həsən padşahın dostlarından və tərəfdarlarından olan İbrahim bəy Qaramanlı vəfat etdi. Sonra xəbər çatdı ki, Məlik Aslan Zülqədər Qaraman vilayətini qarət edib və o vilayətin əhalisi Həsən padşahın köməyinin kölgəsinə sığınmağa təşəbbüs göstəriblər. O

[1135] Kazerun – İranın Fars vilayətində, Şirazdan qərbdə yerləşən şəhər.
[1136] Sərdsirat – "yaylaqlar" deməkdir.
[1137] Heytəm – Türkiyənin cənub-şərqindəki Şırnak vilayətinin Cizrə ilçəsində yerləşir (bax: *Öztürk, şərhlər, s.414*).
[1138] Həsənkeyf hakimi Məlik Xələf Əyyubi nəzərdə tutulur *(Nəvai, şərhlər, s.631).*
[1139] Paris nüsxəsi: "Bağdadlılar".

həzrət o məzlumların xahişi ilə cahanı himayə edən bayrağını Məlik Aslanın zülmünü dəf etmək üçün Qaraman tərəfə yönəltdi və o vilayəti öz himayəsi altına alıb Məlik Aslanın vəhşi pəncəsindən qurtardı. O, zülqədər qəbilələrini və Məlik Aslanı məğlub edib əzdi, o vilayətin idarəçiliyini İshaq bəyə verdi və qışlağa yönəldi.

Cahanşah padşah bu baharda və yayda Savə qışlağından çıxıb, Bağdada getmək və Pirbudağı ortadan qaldırmaq üçün tədricən İraq yaylağında irəliləməyə başladı. Nəhayət, qışlaq vaxtında Bağdad ətrafına çatdı. Onun əmri ilə Reydən ərəb dəvələrinə taxıl yükləyib Həmədan vilayətinə gətirirdilər və oradan bəratdarlar[1140] öz ulaqlarına nəql edib öz ordugahlarına aparırdılar. Ərəblər bu daşıma işinin ağırlığı ucbatından onun zülm yükünü səbir boyunlarından yerə atıb köç etdilər və Reyin imarət və təsərrüfat sahiblərindən olan Dərviş Cəlaləddin və Dərviş Şəmsəddin kimi Rey əyanları ilə birlikdə Xorasana getdilər. Sultan Əbu-Səid mirzə onlara hörmət edib yer verdi və nəvaziş göstərdi.

### Sultan Hüseyn mirzənin yenidən Xorasan məmləkətinə gəlməsi və Sultan Əbu-Səid Kürəkanın əmirləri ilə müharibə etməsi haqqında

Ulu Yaradanın möhkəm dəstəyi ilə üfüqlər hökmdarı (Sultan Hüseyn mirzə) Sultan Əbu-Səidin Mazandaran vilayətindən hərəkət etməsi ucbatından gediş yüyənini Əvaq tərəfə çevirdi və bir müddət Xarəzm və Vəzir şəhəri ətrafında zəmanə ilə dəmsaz olub gününü keçirdi.

Sözügedən il o, yenidən müzəffər bayrağını qaldırdı və Xorasan tərəfə hərəkət etdi. Xivəqdən Tərana gedib, oradan Əbivərdə tələsdi. [Lakin daha sonra] Əbivərddən dönüb, Xəbuşandan keçdi. Nişapurun havası onun qalibiyyətli məiyyətinin [qaldırdığı] tozanaqdan ənbər qoxusu saçdı. Ədalətli və səxavətli sultanın ali bayraqları Nişapur şəhərindən [çıxıb] Türüqi-Dərviş yolu ilə Turşizə doğru hərəkətə gəldilər. Sultan Əbu-Səid Badğis yaylağında bu xəbəri eşidib taqətsiz oldu və oradan köçüb Fuşənc[1141] vilayəti qarşısında dayandı. Həmin vaxt o, Əmir Şir Hacı və Əhmədyar kimi böyük əmirləri bir neçə min cəsur əsgərlə zəfər əlamətli məiyyətin üzərinə göndərdi. Turşiz bölgəsində iki qoşun qarşılaşdı. Sultan Hüseyn mirzə səksən nəfər yaxşı silahlanmış süvari ilə sayları min beş yüz nəfərə çatan düşmənlərin qarşısında döyüş səfi çəkdi. Hər iki tərəfdən mərd kişilər savaş və döyüş meydanına [at] çapdılar. Ox vızıltısı və qılınc sədası qalxdı. O gün Sultan Hüseyn mirzə qızmış şir kimi düşmənlərin səfinə həmlə edib, dastan qəhrəmanı olan Rüstəmin şücaətinin üstündən xətt çəkdi.

Nəzm

“Kamanı səadət oxuna yoldaş,
Xədəngi əcəl oxuna sirdaş.
Oxundan və kamanından əcəl buraxırdı,
Göy qurşağından tökülürdü ölüm yağışı.
Nizəsinin qamışı əcəldən əl aparmış,
Kin çubuğu ilə əcəlin əlini bağlamışdı”.

O, qoşun qıran düşmənlərdən doqquz nəfərini özü şəxsən qılıncdan keçirdi. Sultan Əbu-Səidin əmirləri müqavimət göstərməyə tab gətirməyib fərar etməyi qərara aldılar. Qılıncdan qurtulmuş əsgərlər ali orduya gəldilər. Sultan Hüseyn mirzə bu adlı-sanlı qələbədən sonra müqəddəs Məşhədə gedib, oradan da Mərvə yollandı və Mərv şəhərindən də yüyənini Xarəzm vilayətinə və Əvaq yurduna çevirib çapdı. Səadətli sultanın ardınca məsafələri qət edən bəzi müxaliflər onun mübarək məiyyətinin tozuna belə çata bilmədikləri üçün xoflu və çaşqın bir vəziyyətdə geri döndülər.

### Müxtəlif əhvalatlar

Bu il Çingiz xanın oğlu Cağatay xanın nəslindən olan Yunis xan yenidən məğlubiyyətə uğrayıb, Sultan Əbu-Səidin yanına gələrək ondan hörmət gördü. [Sultan Əbu-Səid] ona kömək etmək üçün bir neçə tü-

[1140] Bəratdar – bərat sənədi əsasında vergi toplamaq hüququ almış şəxslər.
[1141] Fuşənc (Puşəng) – Əfqanıstanda, Heratdan qərb tərəfdə tarixi şəhər.

mən qoşun verdi və onun qızı Qutluq Nigar xanımı öz oğlu Ömərşeyx mirzə üçün istədi. Babur padşah həmin qadından doğulmuşdur.

Həmçinin bu il Sultan Əbu-Səid vəzirlərin təqsirlərini araşdırdı. Xoca Qütbəddin Tavus, Xoca İsmayıl və Xoca Nemətulla işdən çıxarıldı. Xoca Şəmsəddin Məhəmməd ərz etdi ki, "mən camaatdan çoxlu rüşvət almışam, amma divan malından heç nəyi mənimsəməmişəm". O həzrət buyurdu ki, "hər nə yemisənsə, sənə bağışlayıram; amma səni vəzirlikdən çıxarıram". Xoca diz çöküb üzüyünü çıxardı və sultanın oturduğu keçənin küncünə qoydu.

Həmçinin bu il Səmərqənd şəhərində taun baş verdi və çox insanlar həlak oldular.

**Ölümlər**

Qaramanoğlu Məhəmməd bəyin oğlu İbrahim bəy bu il hərəkət bayrağını axirət tərəfə qaldırdı. Onun səltənət əyyamı qırx iki il olmuşdur. Məmləkəti indi Qaraman [adı] ilə məşhur olan Yunan (İoniya) diyarıdır. Qəsəbələrdən savayı, orada yeddi şəhər var: Konya, Qeysəriyyə[1142], Herakliya[1143], Aksaray[1144], Larəndə[1145], Akşehir[1146] və Nigde[1147].

Onun ölümündən sonra oğulları İshaq bəy, Pir Əhməd bəy və Qasım bəy bir-biriləri ilə münaqişə etdilər. Övladlarının böyüyü olan İshaq bəy Diyarbəkrə gedib Həsən padşahdan yardım istədi. Pir Əhməd isə Rum sultanına sığındı[1148].

İshaq bəy, Ağqoyunlu qoşunu ilə ittifaqda Qaraman məmləkətinə gəldi. Türkman qoşunları və imansız qarətkarlar bütün şəhəri və vilayəti çapıb-talayaraq bir sıra zərər və xəsarət yetirdilər.

Amma Rum padşahı Sultan Məhəmməd, Pir Əhməd bəy bibisi oğlu olduğu üçün Antalya valisi Həmzə bəyi Anadolu qoşunları ilə Pir Əhməd bəy Qaramanoğlunun yardımına göndərdi. Onlar tam əzəmətlə Qaraman diyarına yetişdilər. İshaq bəy müqavimət göstərməyə taqət tapmayıb, arvad-uşağını Silifke[1149] qalasında qoyaraq Diyarbəkr tərəfə qaçdı. Pir Əhməd bəy məmləkəti zəbt etdikdən sonra Qaramanın bəzi bölgələrini sultanın vəkillərinə təslim etdi və Həmzə bəylə birlikdə gəlmiş əmirlərin və hərbçilərin (sipahilərin) hər birinə ənam verərək təşəkkür etdi. Rum ordusu o sərhəddən və ölkədən çıxdıqdan sonra kiçik qardaş olan Qasım bəyin fəsadları üzündən qardaşlar arasında döyüş və vuruş baş verdi və əmin-amanlıq məskəni olan Qaraman o üç namehriban qardaşın münaqişəsi ucbatından viran oldu.

**869-CU İLDƏ (03.09.1464 – 23.08.1465) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT**

Bu il bütün kafir sultanları Çex, Engirüs, Firəngistan, Alman və Rus məmləkətləri hüdudundan Ruma yönəldilər. Engirüs, Leh və Çex padşahı[1150] Bosnaya hərəkət etdi. Firəng hakimləri dəniz üzərindən sayı ulduzlar qədər olan gəmilərlə, dənizin dalğalarından daha artıq sayda ordu ilə, saysız-hesabsız top-tüfənglə Mora dənizinin sahillərinə çıxdılar. Kezmiye qalasını[1151] təmir etdikdən sonra o diyarın qalalarının ən əzəmətlisi olan Arqos qalasını əhatəyə aldılar və Rum ordusunun dənizdən gəliş-gediş yolunu bağladılar. O zaman Əlvan bəyin oğlu Sinan bəy qalanı möhkəmləndirib top-tüfəng zərbəsi ilə Firəng qoşununu yaraladı və öldürdü. Sonra firənglilər qalanı top-tüfəng zərbəsi ilə yerlə yeksan etdilər.

Nəhayət, ulduzlar şahı (günəş) civə rəngli eyvandan qərb üfüqünə hərəkət etdi və gündüzün ürək işıqlandıran camalı qaranlıq niqabı içində gizləndi.

---

1142 Qeysəriyyə - Türkiyənin Kayseri şəhəri.
1143 Herakliya – indiki Konya vilayətinin Ereğli ilçəsi.
1144 Aksaray – bu şəhər Kayseri – Konya yolu üzərində yerləşir və hal-hazırda vilayət mərkəzidir.
1145 Larəndə - Türkiyənin indiki Karaman şəhərinin tarixi adıdır. Konyadan cənub-şərqdə yerləşir.
1146 Akşehir – Konya ilə Afyonkarahisar arasında yerləşir.
1147 Nigde (Niğde) – Türkiyədə vilayət mərkəzi. Aksaraydan cənub-şərqdə və Kayseridən cənub-qərbdə yerləşir.
1148 Qaraman bəyi İbrahim bəyin Osmanlı sultanı II Muradın bacısından altı oğlu vardı: Pir Əhməd, Qasım, Qaraman, Nuri-sufi, Əlaəddin və Süleyman. Kəniz olduğu ehtimal edilən başqa bir qadından isə İshaq adlı bir oğlu vardı *(Nəvai, şərhlər, s.636)*.
1149 Silifke – Türkiyənin Mersin vilayətinin Silifke ilçəsində tarixi bir qala.
1150 Engirüs (Macarıstan), Leh (Polşa) və Çex padşahı dedikdə Matyas Koron, Firəng hakimləri dedikdə isə Venesiya dövlət xadimləri nəzərdə tutulur *(Nəvai, şərhlər, s.636)*.
1151 Yəqin ki, burada Peloponnes yarımadasını Yunanıstanın digər hissəsinə birləşdirən dar keçid üzərində qurulmuş Hekzamiliyon səddi nəzərdə tutulmuşdur *(Nəvai, şərhlər, s.637)*.

Şeir

"Elə bir gecə idi ki, qarğadan da qara idi zənci kimi,
Yeni ay isə zəncinin əlindəki çıraq kimi idi.
Nə quş səsi vardı, nə də vəhşi heyvanların ulaması,
Zəmanə yaxşıya və pisə dilini bağlamışdı.
Elə qaranlıq gecə idi ki, dodaqdan çıxan səs,
Qaranlığın çoxluğundan qulağa yol tapa bilmirdi".

Sinan bəy bahadırlardan altmış nəfərlə gizli yoldan kafirlərin üzərinə gecə basqını etdi. Həmin günlərdə nisan (aprel) yağışının qətrələrindən artıq sayda bir ordu ilə sultanın bayraqlarının gəlişinin avazı onlara (düşmənlərə) çatmışdı və ürəkləri qorxaq, könülləri ürkək olmuşdu. Ona görə də həmin imansız güruh can qorxusundan mövqelərini tərk edib qaçış yolunu tutdu. Rum ordusu onları təqib edib bir çoxlarını qətlə yetirdi. Onların bütün nəfis əşyalarını, mallarını, yüklərini, hərb və savaş ləvazimatlarını ələ keçirib mənimsədilər.

Mahmud paşa Kezmiye qalası yaxınlığına çatdıqda bu xəbəri eşitdi. O, Kezmiye qalasını fəth edib sultanın dərgahına yönəldi. Sultan onu Mora məmləkətində qoydu və özü nəfis vücudu ilə Engirüsün talesiz kralının üzərinə yollandı. Çünki o, Yayıtçı (Yayça) qalasını işğal etmişdi. Sofiya məmləkətinin səthi dəniz kimi coşan və şimşək kimi gurlayan ordunun dayanacaq yerinə çevrildikdə, [sultan] bir neçə gün orada qaldı.

O əsnada xəbər gəldi ki, Firəng kafirləri Mudili (Midilli) qalasını mühasirəyə almışlar. Ona görə də hökmdar fərman verdi ki, vəziri-əzəm Mahmud paşa ordu və qoşunla Mudili əhalisinin imdadına yetsin, Gelibolu keçidində isə külək kimi sürətli və asimana ucalan gəmilər dəniz üzərində tərtib edilsin. Ona görə də Mahmud paşa yola düşdü. İslam ordusunun bayraqlarının [gəlişi] xəbəri yaramaz firənglərə çatdıqda, özlərinin nəhs ulduz altında qərar tutmuş talelərinə uyğun olaraq, pozğun və namussuz kafirlər səma rəngli dəniz vasitəsilə özlərinin küfr və tüğyanla dolu məskənlərinə qayıtdılar. Mahmud paşa mülki işləri yoluna qoyduqdan sonra [sultanın] hüzuruna tələsdi.

Azğın Engirüs kralı namuslu sultanın gəlişini eşitdikdə qaçış yolunu tutdu. Zəfərə yaxın olan sultan Engirüsü fəth edib[1152], onların yükləri və əşyaları arasından ələ keçirilmiş olan və adamların ağlını heyran qoyan çox qəribə bir şüşəni töhfə olaraq Sultan Əbu-Səid Kürəkana göndərdi. Sultan Əbu-Səid şüşəyə tamaşa etdikdə bu qəribə əşyaya son dərəcə heyran qaldı. Onu böyük bir iltifat və diqqətlə hərəmsaraya gətirdi. O qəribə əşya, həqiqən də, dünya sənətkarlığının elə bir gözəl bir nümunəsi və Adəm övladının peşəkarlığının elə bir göstəricisi idi ki, fələyin hoqqabaz həngaməsində və asimanın şüşə düzəldən karxanasında ona valeh olmuş və heyran qalmışdılar. Təqdirin səriştəsi ilə tədbirin ayağına zəncir vuran bu şüşə min əhsənə və alqışa layiq idi.

O əsnada cavanbəxt şahzadə Cəlalədin Mirzə Sultan Mahmud, sultanın fərmanı ilə Mazandarandan Xorasana gəldi ki, hər biri səltənət sədəfinin incisi və məmləkət bürcünün sakini olan digər şahzadələrlə birlikdə peyğəmbər şəriətinin və Mustafayi ayinin (islam dininin) qaydalarına uyğun surətdə sünnət edilsin. Şahzadə zilqədə (25.06-24.07.1465) ayının axırında darüssəltənəyə (səltənət mərkəzinə) çatıb sünnət edildi.

Elə həmin gün xoş bir təsadüf nəticəsində üfüqlərin böyüklərinin öndəgedəni olan şəriətin və dinin dəlili (Bürhanüş-şəriət vəd-din) Şeyxülislam Xoca Mövlana[1153] – ali kölgəsi davam etsin – darülmülk Səmərqənddən təşrif gətirdi və olduqca təvazökar bir şəkildə səltənət şüarlı həzrətin hüzuruna gəldi. O həzrət dəniz kimi səxavətli əlini mal bağışlamaq üçün açdı və aləm sakinlərinin muradını nağd bir şəkildə onların murad ətəklərinə qoydu.

[1152] Paris nüsxəsində verilmiş bu məlumat yanlışdır. Çünki həmin ildə Osmanlı sultanı Macarıstanı fəth etməmiş, Bosniyada Macarıstan ordusuna qarşı əməliyyatlar aparmışdı. Bu cümlələrin əvəzində Nuruosmaniyyə nüsxəsində yazılanlar daha doğrudur: "Engirüsün azğın kralı sultanın gəlişini eşitdikdə, Yayıtçanın fəthi ilə kifayətlənib Bosna diyarına tərəf qayıtdı. Sultan öz paytaxtına geri döndü" (bax: *Nəvai, şərhlər, s.638-641*).

[1153] Yəni Xoca Üsaməddinin oğlu Xoca Mövlana Səmərqəndi. O, 11 şəvval 876-cı ildə (22.03.1472) vəfat etmişdir *(Nəvai, şərhlər, s.642).*

### Müxtəlif əhvalatlar

Bu il qalmaq (kalmık) kafirlərindən [ibarət] bir tayfa mühafizə altındakı məmləkətlərə (məmaliki-məhrusə) gəlib qarət və tarac etdi. İmkanları çatdığı qədər dağıntıya yol verdilər və çoxlu əsir alıb geri döndülər. Sultan Əbu-Səidin ordusunun dilavərlərindən [ibarət] bir dəstə onların yolunu kəsib çoxlu çalış-vuruşdan sonra o dinsizlərin əksərini gedər-gəlməzə göndərdilər. Onların başlarını arabalara yükləyib Səmərqəndə gətirdilər.

Həmçinin bu il Sultan Əbu-Səid, Əbülxeyr xan Özbəyin qardaşı olan, əmirlər tərəfindən Mərv nahiyəsində əsir alınan və bir müddət Heratda məhbusluqda qalan Seyid Bikə sultana hörmət göstərib onu öz diyarına geri göndərdi.

Həmçinin bu il Cahanşah padşahın elçiləri Sultan Əbu-Səidin dərgahına gəldilər. O həzrət onlara hörmət göstərib geri göndərdi.

Həmçinin bu il sultanın böyük əmirlərindən olan Seyid Əmir Məzid Ərğunun qardaşı Seyid Əsiləddin əbədiyyət aləminə köçdü.

Həmçinin bu il Sultan Əbu-Səid şahzadə Baysunqurun doğumu münasibətilə böyük bir şənlik təşkil edib şəhəri bəzətdirdi. Şəvvalın əvvəllərindən zilhiccənin axırınadək (27.05-23.08.1465) Zağan bağında çardaqlar və talvarlar tərtib etdilər, onun ətrafını Rum qumaşı və Çin zərbaftası ilə bəzədilər. Sənət sahibləri təbii qabiliyyətləri və bacarıqlarının lətafəti ilə növbənöv gözəlliklər nümayiş etdirdilər və onların hər birini son dərəcə ustalıq və mükəmməl bir məharətlə münasib bir yerdə yerləşdirdilər. Çünki dünyanın müxtəlif tərəflərindən sənətkarlar qorunan məmləkətlərə gəlib əzəmətli dərgahda hazır dayanmışdılar və hər biri öz zehninin qüvvəsi ilə qəribə və qeyri-adi gözəlliklər yaradırdılar[1154].

## 870-Cİ İLDƏ (24.08.1465 – 12.08.1466) BAŞ VERMİŞ HADİSƏLƏR

### Sultan Məhəmmədin Bosna vilayətinə qoşun çəkməsi

Bu il Rum padşahı Sultan Məhəmməd ulduzların sayından daha çox olan bir ordu ilə hərəkət bayrağını Yayıtçı (Yayça) qalasına doğru qaldırdı. Ona görə ki, bundan öncə kral oranı tutmuşdu. Rum qoşunu (çərik) o çevrəyə gəlib top-tüfəng atmağa başladı. Sultanın xəbəri pis əməl sahibi olan krala yetişdikdə, Sav (Sava) çayını keçib İzvornik qalasını mühasirəyə aldı. Sultan, Minnətoğlunu yaxşı silahlanmış bahadırlardan [ibarət] bir dəstə ilə Yayıtça qalası ətrafında qoyub kralın üstünə getdi. Bu xəbər pis əməl sahibi olan həmin [krala] çatdıqda yolları bağladı. Sultan, Mahmud paşanı Rumeli ordusu ilə o üzüqaranı dəf etməyə yolladı. Onlar o həndəvərə çatdıqda keçidin bağlı olduğunu gördülər. Çoxsaylı adamları gizli yollarla o qalaya[1155] göndərdilər və sultanın gəlişinin avazını yaydılar. Ona görə də kralın kədərlə dolu əmirləri və dövlət ərkanı iztiraba düşərək can qorxusundan bütün mallarını, əşyalarını, toplarını və tüfənglərini atıb qaçdılar. Qala camaatı onları təqib edib bir çoxlarını qətlə yetirdi. Bəxti dönmüş kafirlərin çoxu özlərini Sav çayına atdılar və suyu keçərkən cəhənnəm atəşinə qovuşdular. Mahmud paşa müzəffər və qalib bir şəkildə, qeyri-məhdud qənimətlərlə Ədirnəyə gəlib alinəsəb padşah tərəfindən yaxşı qarşılandı.

### Müxtəlif əhvalatlar

Bu il Sultan Əbu-Səid Həzarəyə basqın etməkdən ötrü Fuşənc tərəfə hərəkət etdi. Onlar padşahın hərəkətini eşitdikdə peşkəş göndərdilər. Ona görə də sultan Herata geri qayıtdı.

---

[1154] "Mətləüs-səədeyn"də Mahmud mirzənin sünnət toyu və Baysunqurun doğum şənliyi h. 870-ci ilə aid edilmişdir *(Nəvai, şərhlər, s.642)*.

[1155] Yəqin ki, burada Macarıstan kralı Matyasın mühasirəyə aldığı Bosniyanın Zvornik (İzvornik) qalası nəzərdə tutulmuşdur. Həmin qalanı Osmanlı komandanı Əli bəy Mixaloğlu müdafiə edirdi (bax: *Nəvai, şərhlər, s.645*).

## 871-Cİ İLDƏ (13.08.1466 – 01.08.1467) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA

### Yaxşı xasiyyətli Cahanşah padşahın Bağdad tərəfə qoşun çəkməsi və pis xasiyyətli Pirbudağın öldürülməsi

Cahanşah padşah eşitdi ki, Həsənəli Bağdada gedib Mirzə Pirbudaqdan tam hörmət görmüşdür, zındıqlardan və mülhidlərdən [ibarət] bir dəstə onun xidmətindədir; onlar Məhəmməd – Allahın salamı olsun ona – dininə tənə vururlar, namazı və orucu tərk edirlər, islamın qaydalarını ortadan qaldırmağa təşəbbüs göstərirlər, insanlara pis davranırlar və o diyarda şəriət qanunları pozulmuş, xeyriyyə mərkəzləri rövnəqsiz və zinətsiz qalmışdır. Ona görə də İran hökmdarı, türkman padşahı Mirzə Müzəfərəddin Cahanşah sərdarların toplanması üçün bukavulları Azərbaycan və İraq şəhərlərinə göndərdi. Fərmana əsasən, Məhəmmədi mirzə İsfahandan gəldi və digər əmirlər və tiyuldarlar çoxlu qoşunlarla [gəlib] hökmdarın ordusuna qoşuldular. Cahan padşahı türkman qəbilələrini köçürüb orduya əlavə etdi və Xərrəqan yaylağından[1156] tam əzəmət və şövkətlə Bağdad üzərinə hərəkət etdi. O, Diyarbəkrə, Həsən padşahın yanına bacarıqlı elçilər göndərib xəbər verdi ki, "çayın o tərəfini tutub Pirbudağın keçiş yolunu bağlamağınız şərti ilə Mosulu, Ərbili və Sincarı cənabınıza verirəm"[1157]. Bu beytləri də deyib Pirbudağa göndərdi:

Şeir

"Ey oğul, müxaliflik yolundan vaz keç,
Qılıncını at ki, günəş mənəm.
Mülk və xilafət şahsənəmi mənimdir,
Sən xələfsən, sənin xəlifəliyin xətadır.
Qəsb etmə bizim köhnə mənsəbimizi,
Qəsbkarlıq bizim inancımızda rəva deyildir[1158].
Rüstəmə qılınc çəkən Söhrabın,
Heç eşitdinmi ki, nə oldu axırı?[1159]
Bir gün sənə də çatar bu rütbə və məqam,
Atamdan mənə qalmışdır, məndən də sənə qalar".

Mirzə Pirbudaq da atasının yanına bacarıqlı elçilər göndərib bildirdi:

- Bağdadın istehkamı Keyvan eyvanından və Ehramlar mülkünün[1160] binasından daha üstündür. Üfüqləri gəzənlər və aləmin ətrafını səyahət edənlər bundan daha möhkəm bir qala müşahidə etməyiblər. Bu qalanı çoxsaylı qoşunlarım gücü ilə, savaş və döyüş yolu ilə tutmaq mümkün deyildir.

O, həmçinin bu beytləri deyib, cavab olaraq göndərdi:

Nəzm

"Ey sən, dövlətin qəlbini öz camalı ilə şad edən!
Sənə şövkət, bəxt və murad arzulayıram.
Qılınc çəkmə öz oğlunun üstünə,
Öz sevimli gövhərini dəlik-deşik etmə!
Sən yetkin bir padşahsan, xamlıqdan dəm vurma,
Mən səndən doğulmuşam, sən məndən deyil.
Köhnə budaq bostan üçün illətdir,
Cavan fidan gülüstana zinətdir.
Qocalmısan, get, bu cahanda bir küncdə otur,

[1156] Xərrəqan yaylağı – Həmədandan və Dərcəzindən şimalda yerləşir.
[1157] Ağqoyunlu Uzun Həsən onun bu istəyini yerinə yetirdi *(Nəvai, şərhlər, s.646)*.
[1158] Burada ilk üç xəlifəni qəsbkar kimi tanıyan şiə inancına işarə edilmişdir *(Nəvai, şərhlər, s.647)*.
[1159] Firdovsinin "Şahnamə" məsnəvisinə görə, məşhur İran pəhləvanı Rüstəmin türk qadından doğulmuş oğlu Söhrab atasını tanımayaraq onunla döyüşmüş və bu döyüşdə məğlub olaraq həyatını itirmişdir. Burada Cahanşah, oğlu Pirbudağa bu mövzunu xatırlatmaqdadır *(Öztürk, şərhlər, s.425)*.
[1160] Misir ehramları nəzərdə tutulur *(Nəvai, şərhlər, s.647)*.

Sənin oxun sınmışdır, qulağında saxla!
Biz iki cavanıq: mən və mənim bəxtim,
İki cavanla pəncələşməyə çalışma!
Bağdad bölgəsi tamamən mənə aiddir,
Onu xam sevda ilə əldən vermərəm.
Sən məndən taxtı istəyirsənsə,
Mən onu sənə vermərəm, əgər bacarırsansa, al".

Bu xəbər alinəsəb padşaha çatdıqda, bu səbəbdən səba və şimal küləklərini ötüb keçən, fəhm quşunu geridə qoyan, mindiyi atın sürətini yeyin göy qasidinin müəyyənləşdirə bilmədiyi və tozuna iki atlı fələk şahsüvarının yetişə bilmədiyi sürətli bir yürüşlə yola çıxdı.

Beyt

"Tələsdi o dəniz kimi şövkətli sel,
Onun qarşısında dənizlə dağ bir idi.
Həddən artıq sürətlə vadidən keçdi,
Havanın nəfəsi düyünləndi boğazında.
O qədər sürətli idi ki, əgər qışqırsaydı,
Öz qışqırığı arxadan gəlib qulağına çatardı".

Cahanşahın bayraqlarının günəşi İlahi qüdrətin təqdiri ilə o diyarın üzərinə kölgəsini saldıqda Pirbudağın qoşunlarını zərrə kimi sərsəm və qərarsız vəziyyətə saldı. Pirbudaq körpünü çaydan qaldırıb özü çayın o tayında oturdu. Məhəmmədi mirzə zəfər bayraqlı bahadırlarla çaydan keçib Bağdadın o tərəfində qərar tutdu. Ora son dərəcə mətanətli və istehkamlı bir qaladır. Onun hündürlüyü Keyvan eyvanından daha yüksəkdir və onu əhatə edən divarın dairəsi asimanın orbiti (mehvəri) kimi olub, ətrafında xəndəklər qazılmışdı.

Şeir

"Küngürəsinin ucu günəşin başına xəncər kimi uzanıb,
Asimanın hasarını dəlmə-deşik edib.
O qədər hündürdür ki, fələyə qarışıb,
Və ondan kül rəngli bürc töküb.
Əgər ətəyindən kin daşı düşsəydi,
Asiman yerlə bərabər olardı".

Mirzə Pirbudağın adamları qala müdafiəsi ləvazimatını olduqca mətanət və möhkəmliklə hazırlayıb müdafiə olunmağa başladılar. Cahanşahın qoşunları və döyüşkən igidlər dairə kimi qalanın ətrafını bürüdülər və o qalanı nöqtə kimi əhatəyə aldılar.

Günəş Əsəd (Aslan) bürcünə çatdıqda hərarətin çoxluğundan balığın gözündə su qaynayırdı, yer qızmar isti üzündən ipəkdən səmum paltarı geyinmişdi, havanın istiliyi cəhənnəm alovundan xəbər verirdi, suyun qaynarlığı isə cəhənnəmin xilqətini xatırladırdı. Yanmış torpaq od təbiətini almış, qızmar qum qırmızı yaqut rənginə dönmüşdü.

Nəzm

"Günəşin istisindən dəmir suya dönmüş,
Gümüş əriyib civəyə çevrilmişdi.
İstidən dağ vərəmə düçar olmuş,
Daşı isə yatalaq tutmuş.
Necə ki, qazan odda qaynayırsa,
Eləcə də sümüklərin arasında ilik qaynayırdı.
Hərarətdən qan bədəndə qurumuşdu,
Necə ki, Xötən ceyranlarının göbəyində müşk quruyur.
Fələyin kafur rəngli şamı yanırdı,
Onun parıltısından xalq pərvanə kimi odlanırdı.
Əgər bir kəs səhraya ov vurub salsaydı,
O, oraya yetişmədən ov yaxşıca bişərdi.

Səməndər atəşdən ayrılsaydı əgər,
Günəşin istiliyindən dərhal viran olardı".

Cahanşah padşahın ordusu yerin altını qazdı və hərarət üzündən həmin lağımlara doluşdu. İki ilə qədər[1161] müzəffər əsgərlər Bağdad qapısında dayandılar. İki tərəf hər gün içəridən və bayırdan döyüş apardı və bir-birini yox edib ortadan qaldırmağa çalışdı. O əsnada aclıq və qıtlıq o dərəcəyə çatdı ki, itdən və pişikdən nişan qalmadı.

Şeir

"Qıtlıq o həddə idi ki, insan ifrat gücsüzlük ucbatından,
Şam kimi atəşdə öz cismini yandırır və ondan bəslənirdi.
Gecə, bütün gecə uşağının nəva və naləsi ilə qadın,
Ərinin qanını çəkirdi qafa tasından qədəh kimi".

Axırda Pirbudaq xalqın bir qismini şəhərdən çıxardı və bəzi əsgərlərinə qarşı etimadsız oldu. Bəziləri fərar edib Cahanşah padşahın xidmətinə gəldilər. Başqaları da fərar etmək niyyətində idilər. O, bundan xəbər tutduqda həmin adamların bəzilərini qətlə yetirdi, bəzilərini isə suya tulladı. Özünün iki arvadını qətlə yetirdi. [Bunlardan] biri Şirvan padşahı Əmir Xəlilullanın qızı idi. Digəri isə [əvvəllər] İsgəndərin oğlu Əlvənd mirzənin arvadlarından olmuş və onun ölümündən sonra [Pirbudaq bu qadını] özünə nikahlamışdı. Fərar etmiş şəxslərin uşaqlarını və yaxınlarını çaya atdırdı. Nəhayət, belə qərara aldı ki, ona məzəmmət gətirmiş müxaliflik adətini tərk etsin və sülh qapısından daxil olub uzlaşmanın əsasını möhkəmlətsin. Ona görə də Cahanşah padşahın divan əmiri olan Pirzad bəyin qardaşı Əbdürrəhman Buxarini elçi sifəti ilə atasının hüzuruna göndərdi ki, padşaha və dövlət ərkanına and versin.

Əmir Əbdürrəhman dərgaha tələsib əhd-peyman bağladıqdan və "Quran"a and içdirdikdən sonra Mirzə Pirbudaq malik olduğu xəzinələri atasının hüzuruna göndərdi və şəhəri də təslim edərək çıxıb getmək üçün hazırlıq görməyə başladı. Elə bu vaxt Cahanşah padşahın adamları şəhərə tökülüşdülər. Məhəmmədi mirzə və Pir Məhəmməd bəy Təvaçı qılınclarını çəkib onun evinin içinə daxil oldular. O, qorxu ilə yerindən sıçrayıb Pir Məhəmməd bəy Təvaçını söyərək dedi:

- Əgər mənim öldürülməyim haqqında hökm çıxmışdırsa, gərək Məhəmmədi məni öldürsün. Sənin mənim öldürülməyimə nə dəxlin var?

O, bu sözləri dediyi vaxt ona zərbələr endirdilər və işini bitirdilər. Təəccüblüdür ki, Pirbudağın Şirazdan Bağdada gəldiyi və Cahanşah padşahın hələ Bağdaddan uzaq olduğu zamanda hər iki-üç gündə bir dəfə çay tərəfdən, Pirbudağın evinin qarşısından bir şəxs gələrdi və uca səslə hər zaman bir dildə, bəzən türkcə, bəzən farsca və bəzən ərəbcə Pirbudaq mirzəni söyərək deyərdi:

- Ey bədbəxt, tövbə et! Yoxsa atan gələcək və səni öldürəcək. Sənin bütün tabeçilərini, qadınlarını və uşaqlarını əsir edəcək.

Pirbudaq bu hadisədən narahat olub onu tapmaq üçün çaya gəmilər göndərərdi, lakin [onu tutmağa] müyəssər olmazdı və o, hər dəfə bir tərəfdə gizlənərdi. Təqribən üç ay belə oldu.

Onun sağ əli və təvaçısı olan və hücumun qarşısını almaq və daruğanı qəbul etmək üçün darvazada dayanan Məhəmməd Əlişəkər hücumun şiddəti və hiddəti qarşısında ayaqlar altında qalıb öldürüldü. Şəhər bir göz qırpımında ələ keçirildi. Kişilərin və qadınların ürəkləri qan tufanının dalğalanmasından Bağdad şəhəri kimi xaraba qaldı, gözlər göz yaşı və ağlamaq yağışının selindən Şətti-Bağdad çayı kimi su ilə doldu. Ağlayan və fəğan edən uşaqlar, döşdən daman süd kimi, analarının çiynindən və ətəyindən düşüb torpağa və qana qəltan oldular. Halalla haramın bir-birinə qarışması ucbatından ay üzlü və hilal qaşlı bakirə gözəllərin qaşları kədərdən çatıldı.

"Bəsrə xarab olduqdan sonra" (yəni iş işdən keçdikdən sonra) [Cahanşah] Bağdaddan köç edib darüssəltənə Təbrizə yönəldi. Orada qışlaq etdikdən sonra Şirvanı fəth etmək üçün hərəkətə gəldi. Türkman qoşununun qorxusundan Şamaxının və Şirvan vilayətinin sakinlərinin iqamətinin və istiqamətinin bünövrəsi sarsıldı və onlar yüklərini, mallarını və arvad-uşaqlarını Dərbənd tərəfə köçürməklə məşğul oldular.

[1161] "Həbibüs-siyər"ə görə, bir il *(Nəvai, şərhlər, s.649).*

## Diyarbəkrdə baş vermiş əhvalatların və hadisələrin bir qismi[1162]

Baharın əvvəllərində Həsən padşah yürüş bayrağını Gürcüstan tərəfə qaldırdı və Bingöldən başlayan, Anə, Hədisə, Hillə və Cəzairdən keçən, Dəcləyə birləşən və Ümman dənizinə tökülən Fərat çayından keçib Tarmuq yaylağına[1163] və Nəmiqara gəldi.

Şeir

"Təbiəti dəniz və Kövsər[1164] kimi,
Dərinliyi dənizə, təmizliyi Kövsərə bənzər.
Onun içində üzür gümüş rəngli balıqlar,
Nurlu səmadakı təzə ay kimi".

Və kafirlərin ərazisində olan Səmaqar qalasını[1165] əhatəyə aldı. Qalibiyyətli qoşunlar hücum edib qalaya daxil oldular və çoxlu mallar qarət və tarac edib, geri dönərək Ərzuruma gəldilər. [Həsən padşah] oradan şahzadə Xəlil sultanı, Xəlil Təvaçını, Əmir bəyi, Söhrab bəyi, Şeyx Həsən bəyi və Seyid Mahmud Ərəbgirlünü yaxşı silahlanmış bahadırlar dəstəsi ilə Kəmaxı və Qarahisarı mühasirəyə almağa göndərdi. Onlar qalanı bir mərkəz kimi dövrəyə aldılar. Bir neçə gün sonra qala əhli təngə gəlib qalanı təslim etdi. Qarahisarın hakimliyini Uğurlu Məhəmmədə verən Həsən padşah Tərcana yönəldi.

O əsnada xəbər gəldi ki, Cahanşah padşahın qoşunu Əxlat tərəfə sürətli yürüş etmişdir. O həzrət əsla onlara etina etməyib yerindən hərəkət etmədi. Cahanşah padşah elçilər göndərib üzrxahlıq etdi. [Həsən padşah] hərəkət bayrağını oradan Siirt[1166] tərəfə qaldırdı. O əsnada Cahanşahın elçisi olan İnal adlı bukavul gəlib qızıl qılınc kəməri gətirdi. O həzrət qılınc kəmərini belinə bağlayıb buyurdu ki, qılınc kəmərini göndərmək səltənət işini təhvil verməkdir. Bir neçə gün sonra o, Siirt qalasını fəth etdi.

Həmin il Cahanşah padşah Şirazda idi. Bundan öncə padşah Həsən bəyin azad etdiyi Savalan bəy elçi sifəti ilə gəlib onun kimya kimi təsirli nəzərləri qarşısına çıxdı.

Həsən padşah həmin il Rəqqə şəhərində qışlaq etdi. Növbəti il o, hərəkət bayrağını Ərzurum tərəfə qaldırdı. Həmin zaman Ərzurum şəhəri əsgərlərdən xali idi. O, Cahanşahla bağladığı anlaşmaya əsasən, həmin diyara basqın etmədi. Oradan Avnik tərəfə gedib o diyara basqın etdi və istila bayrağını yüksəltdi. Oradan da Axısqaya[1167] yetişdi və Qara dəniz sahilinə qədər irəlilədi. O, elə yerlərə gedib çatdı ki, islam əhlindən hələ heç kəs oralara gedib çatmamışdı. O, sağ-salamat bir şəkildə, nağd [puldan], cins [maldan] və heyvanlardan [ibarət] qənimətlərlə qayıtdı və Ərzincan səhrasına çatıb geri döndü. Yenidən bu il baharın əvvəllərində Xarputa yönəldi.

O əsnada Əlbistan və Mərəş[1168] hökmdarı Məlik Aslan zülqədər tayfasını toplayıb Fərat çayını keçdi. Süleyman bəy Bicən və Xəlil Təvaçının qardaşı İbrahim ağa onların qaravulları ilə vuruşub ələ keçirildilər. Bu xəbər Həsən padşaha çatdıqda bütün Ağqoyunlu tayfalarını toplayıb zülqədərlərin üstünə getdi. Məlik Aslan müqavimət göstərməyə taqət gətirməyib Əlbistan tərəfə qaçdı. O həzrət köçhaköçlə Əlbistana yönəldi. Məlik Aslan bundan xəbər tutan kimi Əsəndərə mövqeyinə getdi. O, hökmdarın dərgahına elçilər göndərib bildirdi ki, "mən bəndə, sizin tabeçilərinizdənəm və hər nə xidmət buyursanız, yerinə yetirərəm". Həsən padşah cavab verdi ki, "aramızda o vaxt məhəbbət qaydaları möhkəmlənər ki, Xarput qalasını bizim mülazimlərimizə təslim edəsən və Çiçəkoğlu ilə Mövlana Yəhyanı bu tərəfə göndərəsən". Elçiləri yolladıqdan sonra Həsən padşah onların üzərinə hərəkət etdi. Məlik Aslan Zülqədər cövşən geymiş igidlərin xofundan alaçığını, çadırını, saray pərdəsini və bargahını Əsəndərədə buraxıb can qorxusu ilə Cahan (Ceyhan) çayına qədər heç bir yerdə dayanmadan qaçdı və elçilərini göndərib qalanın açarını Həsən padşahın vəkillərinə təslim etdi. O,

---

[1162] Burada bu başlıq altında verilmiş məlumatları Həsən bəy Rumlu əsas etibarilə "Kitabi-Diyarbəkriyyə"dən götürmüşdür və Ağqoyunlu Uzun Həsənin fəaliyyəti ilə bağlı olan həmin hadisələr sadəcə h. 871-ci ildə deyil, h. 866-871-ci illərdə baş vermiş hadisələrin icmalını əhatə etməkdədir (bax: *Nəvai, şərhlər, s.653-654*).

[1163] Ərzurumun Tortum ilçəsində, Fərat çayının şimalında yerləşir.

[1164] Kövsər – axirətdə Məhəmməd peyğəmbərin öz ümməti ilə yanında görüşəcəyi bildirilən hovuz və nəhr *(M.Ertürk. Havz-ı Kevser // TDVİA, cilt: 16, yıl: 1997, s.546-549).*

[1165] Səmaqar qalası – Türkiyənin Ərzurum vilayətində, Tortum və Oltu arasında yerləşirdi.

[1166] Siirt – Türkiyənin Cənub-Şərqi Anadolu regionunda, Bitlisdən cənubda yerləşən şəhər və vilayət mərkəzi.

[1167] Axısqa – Gürcüstanda, Türkiyə sərhədi yaxınlığında, Kür çayı boyunda yerləşən bir bölgə.

[1168] Əlbistan – Türkiyənin cənubunda, Maraş şəhərindən şimalda, Ceyhan çayının yuxarı axarlarında şəhər. Mərəş (Maraş) – Türkiyənin cənubunda, Ceyhan çayından şərq tərəfdə yerləşən indiki Kahramanmaraş şəhəri.

həmçinin məhbus olan Süleyman Bicənlə İbrahim ağaya dəyərli xələtlər verib onları dərgaha yolladı. Buna görə də o həzrət malik olduğu mürüvvət üzündən qalanın bahası olan dörd min əşrəfini Məlik Aslana göndərdi. Ondan sonra isə geri dönüb Amiddə qışlaq etdi.

O əsnada Cahanşah padşahın elçiləri Pirbudağın qətli xəbərini ərz etdilər və Mirzə Pirbudağın mülazimlərindən bir neçəsinin nizəyə taxılmış başını gətirib Həsən padşaha təqdim etdilər. Həsən padşah da Həsən Hacı vasitəsilə Cahanşah padşahın hüzuruna bir tövlə atı göndərdi.

### Müxtəlif əhvalatlar

Bu il Cahanşah padşah öz əmirülümərası olan Əmir Şahəli Bayramini bir neçə xəyanətdə ittiham edərək qalaya göndərdi (qalada həbs etdi).

Həmçinin bu il Həsən padşahın mülazimi Mahmud bəy misirlilərdən aldığı qalanı yenidən onlara verdi.

Bu il Sultan Məhəmməd hədsiz ordu ilə hərəkət bayrağını Arnavut tərəfə qaldırdı. Çünki o diyarın hakimləri müxaliflik etməyə başlamışdılar. Məlumdur ki, kafir və pozğun tayfalar arasında xəbisliyin şiddəti baxımından heç kəs o tayfa qədər yaramaz deyildir. Onlar [ərazilərindəki] dağların möhkəmliyi və yüksəkliyi, təpələrin dikliyi səbəbindən heç bir ali mənşəli padşaha tabe olmamışdılar. Onlar tovhid yolunu seçmiş heç bir kimsənin hökmdarlığını qəbul etmirdilər. Sultan Məhəmməd ucsuz-bucaqsız bir ordu ilə onların arasına gəlib çatdıqda onlar həmin şövkətli qoşunun qorxusundan dağ başına sığındılar.

Rum qoşunu savaşa başlayıb qısa müddətdə onların sığınacaqlarını ələ keçirdi. O qəddar tayfanın dikbaş sərdarlarını və zülmkar başqaldıranlarını iti qılıncın zərbəsi ilə cəhənnəmə göndərdilər. Onların qadınlarını və uşaqlarını əsir etdilər. O qədər əsir ələ keçirildi ki, ondan sonra üç min dinar qiyməti olan bir qulamı üç yüz gümüş dirhəmə satsalar da, heç kim almırdı. [Sultan Məhəmməd] o diyarın fəthindən sonra orada möhkəm bir qala inşa etdirdi. Onun tamamlanmasından sonra özü Ədirnə tərəfə qayıtdı, öz etimadlı adamlarından [ibarət] çoxsaylı bir dəstəni isə orada qoydu.

Sultan Məhəmməd zamanında İsgəndər[1169] adlı birisi mürtəd olub, qalanı Sultan Məhəmmədin mülazimlərinin əlindən aldı. Bu xəbər qurunun və dənizin sultanına çatdıqda yenidən o diyara yönəldi və oradakı şəhərlərin əksərinə basqın etdi. “Xain İsgəndər” adı ilə məşhur olan mürtəd İsgəndər çör-çöp kimi özünü Firəng dənizinə atıb Rum əsgərlərinin əlindən xilas oldu. Sultan o mülkü zəbt etdikdən sonra Ədirnə tərəfə qayıtdı.

## 872-Cİ İLDƏ (02.08.1467 – 21.07.1468) BAŞ VERMİŞ HADİSƏLƏR

### Rum padşahı Sultan Məhəmmədin Arnavut diyarına qoşun çəkməsi və Xain İsgəndərin fərar etməsi

Daha öncə qeyd edildi ki, Sultan Məhəmmədə sığınmış Pir Əhməd bəy Qaramanoğlu, sultanın köməyi sayəsində bütün Qaraman diyarına yiyələndi və Kəvələ qalasını[1170] sultanın mülazimlərinə təslim etdi. Bu il o, müxaliflik izhar edib, öz qohum-əqrəbasından və hər diyardan çoxlu qoşun toplayaraq Kəvələ qalası üzərinə gəldi. O zaman sultanın tərəfindən o qalanın valisi olan Əhməd bəy döyüşə və vuruşa hazırlaşdı.

Nəzm

“O, günəşin tez yeriyən atına bənzəyən,
İki rəngli asimanın pələnginə oxşayan,
Quyruqlu Əqrəb ulduzunu xatırladan,
Çölləri gəzib-dolaşan atından endi”.

O qaranlıq gecədə o çaşqın bədbəxt, qulamların üzərinə gecə basqını etdi. Cəld igidlərdən və şanlı bahadırlardan [ibarət] bir dəstə qaramanlılarla mərdanə savaşdı. Belə ki, qalanın içindən və bayırından qan arxları axmağa başladı.

[1169] Alban (Arnavut) feodallarındandır. Əvvəlcə islamı qəbul edib Osmanlı dövlətinə xidmət göstərsə də, 1443-cü ildə Osmanlıya qarşı üsyan qaldırmış və vəfat etdiyi 1468-ci ilə qədər bu mübarizəsini davam etdirmişdir.

[1170] Kəvələ (Gavele və ya Kavalla) qalası – Bizans dövründən qalma bir qala olub, Konya yaxınlığında yerləşirdi *(Nəvai, şərhlər, s.660).*

Beyt

“Axar suyun çör-çöpü apardığı kimi,
Qan seli fələkləri yerindən dəbərtdi”.

O talesiz güruh qalaya daxil ola bilməyərək tam rəzalətlə Larəndə şəhərinə tələsdi. Ona görə də sultan zərərin dəf edilməsi və şərin ortadan qaldırılması üçün Məhəmməd paşa Rumini Anadolu əsgərləri ilə Qaramanoğlunun üstünə göndərdi. Pir Əhməd bəy Qaramanoğlu qorxusundan Daşeli dağlarına sığındı. Əmin-amanlıq məkanı olan Qaraman asilərin şərindən və qarışıqlığından xilas olduqdan sonra Məhəmməd paşa məmləkətin asayişi üçün Larəndə qalasını təmir etdi və qoşunun əksəriyyətinə izin verib dörd sancaq əmirini öz yanında saxladı. Həmin qış Pir Əhməd bəy Qaramanoğlu bir dəstə fəsadçı ilə Daşelidən çıxıb özünü Larəndə şəhərinin qapısına yetirdi. Məhəmməd paşa onu qarşılamaq üçün [şəhərdən] çıxdı. Ağır bir hərb baş verdi. Hərçənd o hiyləgər (Qaramanoğlu) çoxlu cəhd və səy göstərib döyüşsə də, bir faydası olmadı. Ona görə də öz əvvəlki yerinə qayıtdı.

Bu xəbər qurunun və dənizin padşahına çatdıqda onun qəzəb atəşi alovlandı. Bu məna nurlu könlünə şəfəq saçdı ki, zəfər ayəli bayrağının pərçiminin tellərini o diyarın gülzar sahəsi üzərində külək yellətmədikcə, fəth və qələbə gülü səadət budağından bitməyəcəkdir. O, yəcuc[1171] səflərindən və göy bürclərindəki ulduzlardan daha artıq sayda bir ordu ilə o paxıl qəddarı dəf etmək üçün qətiyyətlə yola çıxdı.

Sultanın zərnigar tuğunun ayparası Qaraman diyarının üfüqündən doğduqda, Pir Əhməd bəy kölgə kimi günəşin parlaqlığı qarşısında tab gətirməyib, hər dəm zülmət kimi günəş işığından üz çevirərək gecə kimi qara bəxti ilə məğribin qürubunda gizləndi. O, qardaşı Qasım bəylə birlikdə Daşeli dağlarına sığındı. Qəhredici sultanın şiddətinin xofundan, kiçik od qığılcımları dəmirin [döyüldüyü] daşda yox olduğu kimi itib-batdılar. O əsnada böyük qardaşları İshaq bəy hərəkət bayrağını axirət tərəfə yüksəltdi. Qasım bəy də çarəsizlik üzündən Diyarbəkr tərəfə qaçdı və əlini Həsən padşahın ətəyinə uzatdı. Sultan Məhəmməd o diyarın (Qaramanın) idarəçiliyini oğlu Sultan Mustafaya tapşırıb İstanbul tərəfə qayıtdı.

### Diyarbəkrdə olan hadisələr, Cahanşah padşahın Amid diyarına qoşun çəkməsi və o ali məqamlı padşahın Həsən padşah əsgərlərinin əli ilə öldürülməsi

Zəmanə hadisələrinin ucbatından və bəlaların çoxluğu üzündən bütün İran məmləkətlərində və Əcəm ölkəsində əmin-amanlıq pozuldu. “Sən gecəni gündüzə çevirirsən”[1172] fərmanına uyğun olaraq gecənin gündüzə çevrildiyi kimi, şıltaq zamanın iqtidar əli kainat səhifəsini vərəqlədi və Qaraqoyunlu hökmdarlarının və sultanlarının aram və sakit axşamını Ağqoyunlu tayfasının yüksəlişinin səadətli sübhünün dan ağarması dəmi ilə əvəz etdi. Belə ki, bu il yüksək məqamlı hökmdar Müzəffərəddin Cahanşah padşah şəvval [ayının] 10-da[1173] səadət və uğurla, qoşunsuz və ordusuz, təbil və bayraqla Təbrizdən çıxıb köç edə-edə Diyarbəkrə yönəldi. Xoyun Sökmənova meydanı[1174] alinəsəb hökmdarın dayanacaq yeri olduqda, o, döyüşü tərk edib (savaş sayıqlığını əldən verib) əyləncə ilə məşğul oldu. Yaxın və xüsusi adamlarından [ibarət] bir camaatla bərabər əyləncə məclisində oturub fərəh və sevinc qapılarını öz üzünə açdı. Gül rəngli badə şux və yaraşıqlı saqilərin əlində dolanmağa, xoş ahəngli mütrüblərdən ud və çəng nəğməsi yüksəlməyə başladı.

Nəzm

“Dəf mütrübün əlində kamına çatdı,
Sanki o, günəşin pəncəsindəki bir ay kimi idi.
Mahnı oxuyan şəkər dodaqlı gözəllərdən,
Cahan rövnəqləndi başdan-ayağa”.

O, rəqibin gözünün oyaq olmasından və öz cah-calal günlərinin sona yaxınlaşmasından xəbərsiz qalaraq, bu minvalla gündüzü gecə etdi və gecəni gündüzə çevirdi. Bu işrət və əyləncənin həddini aşdığı və bu qəribə işlərin cərəyan etdiyi əsnada ali mənşəli hökmdar tərəfindən Adilcevaz qalasının hakimi olan Mah-

[1171] Yəcuc və məcuc – qədim dini rəvayətlərə görə, Nuh peyğəmbərin oğlu Yafəsin nəslindən olan çoxsaylı, bəstəboy, döyüşkən və olduqca zalım şimal xalqlarıdırlar.
[1172] *Qurani-Kərim, “Ali-İmran” surəsi, 27-ci ayə.*
[1173] Yəqin ki, burada h. 871-ci ilin şəvval ayının 10-u (15.05.1467) nəzərdə tutulmuşdur.
[1174] Xoy şəhərinin bir mənzil qərbində *(Öztürk, şərhlər, s.435).*

mud Mehmandarın qasidi gəlib ərz etdi ki, Həsən padşah tam təchizatlı on iki min nəfər nizədar süvari ilə sürətli yürüş edərək buraya yaxınlaşmaqdadır. Heç kəsin cürəti çatmadı ki, bu xəbəri [Cahanşaha] ərz etsin.

Ertəsi gün Pirzad bəy Buxari, Şah Hacı bəy Həmədani, Rüstəm Yaqubi, Pir Məhmad və onun qardaşı, Qurmişi Şəki, Əmənoğlu Hüseyn, Lələ Səfərşah, Şeyx Bəhlul Cağatay kimi əmirlər, digər sərdarlar və inaqlar[1175] dəstəsi asiman nişanlı dərgaha gəldilər. Padşah onların toplanmasının səbəbini soruşdu. Məhrəm nədimlərdən və həmdəm müqərrəblərdən olan Qazı Abdulla ərz etdi ki, "məgər bir xəbər eşitməmişsiniz?". Ona görə də türkman hökmdarı əmirləri çağırıb xəbərin nədən ibarət olduğunu onlardan soruşdu. Onların məşvərəti ilə yükləri ("ağruq") zəfər nişanlı ordugahın üç fərsəxliyində yerləşən Boyan[1176] qalasına göndərdi. Bir dəstəni də qaravulluq etməyə yolladı. Özü isə nəfis vücudu ilə dərgah əmirləri və ordunun qalan hissəsi ilə atlanıb [Həsən padşahı] qarşılamağa tələsdi. O zaman Həsən padşahın yanından gəlmiş Xızır bəy Tərxandan soruşdu ki, "nə üçün Həsən bəy yürüş etmişdir?". Xızır bəy dedi ki, "bu xəbər həqiqətə uyğun olmayan bir yalandır, hal-hazırda [Həsən] padşah Xarputdadır və bütün Ağqoyunlu tayfa qoşunları da Qəbəsidə[1177] toplanmışlar". Cahanşah padşah bu sözə inanmadı. Onun qəzəb atəşi alovlandı və həmin yalan xəbər onun ürəyində yer elədi. Bu yalanın və bu uydurma xəbərin mənşəyi o idi ki, Xəlil Təvaçı bir dəstə türkman süvarisi ilə ova getmişdi.

Cahanşah padşah, Məhəmməd Süfrəçini Həsən padşahın yanına göndərib bunları bildirdi: "Sürətli yürüşə çıxmağının xəbəri gəldiyi üçün sənin [mənə qarşı] müxalifliyə başlamağın türkə və tacikə, yaxına və uzağa məlum olmuşdur. Bu halda savaş vacibdir. Əgər sən bizə məhəbbətdə sadiqsənsə, heç çəkinmədən dərgaha gəl və ya özün gələ bilmirsənsə, onda oğullarından birini göndər! Əgər dediyimizi qəbul etməsən, Ulu Yaradanın qayğısı ilə əhatə olunmuş, savaş günündə aslana və timsaha bənzəyən, dava zamanı şövkətli və vüqarlı Rüstəmi xatırladan,

Beyt

"Pusquda oxu kamandan çıxardıqda,
Asimanın başını yerə gətirən",

şərəfli, adlı-sanlı və səadətli oğlum Məhəmmədi mirzəni aslan yıxan və fil ovlayan çoxsaylı bir ordu ilə birlikdə səninlə savaşmağa göndərəcəyəm. Əgər o, bir iş görə bilməsə, onda calal sahibi olan həzrətin (Allahın) sevimlisi olan, mübarizə zamanı yarış topunu Bəhram kimi qüvvətli xosrovlardan alan, yarışma vaxtı mükafatı Mərrix kimi intiqamçı igidlərdən qoparan,

Beyt

"Qılıncı qana meyil etdikdə,
Daşdan su və atəş çıxaran",

yaxşı xislətli əziz oğlum Əbu-Yusif mirzəni otuz min nəfər nizədar süvaridən ibarət izdihamlı qoşunla o diyara sürətli yürüş etməyə göndərəcəyəm. Dünya sakinlərinə məlumdur ki, əgər qalibiyyətli qoşunumuz hiddətlə o məmləkətdən keçsə, o diyarda canlı bir adam qalmaz. O məmləkətin yoxsullarının halına nəzər sal ki, bizim qoşunumuzun zərbələri altında paymal, təpikaltı və zay olmasınlar".

Məhəmməd Süfrəçi, Həsən padşahın ordusuna çatdıqda, kobud sözlər söyləyib belə bəyan etdi:

- Cahanşah padşahın cəbbə (zireh) geymiş yüz əlli min süvarisi var.

O həzrət dedi:

- Cahanşahın vəziyyətini bilirəm; onun otuz mindən artıq adamı yoxdur.

Sonra əlavə etdi:

- Mən Şahəli Bayrami kimi deyiləm ki, ona xidmət edim. Cahanşah padşah tünd xasiyyətli və etimadsız bir adamdır. Belə ki, hətta ən kiçik mülazimi olan Məhvəkdən ehtiyat edərək onu qətlə yetirdi.

Elçi kobud sözlər söylədi. O həzrət səbir edib yenə dilə gəldi:

[1175] İnaq – Türk və moğol dövlətlərində islamdan öncəki dövrdən başlayaraq XIX əsrin ikinci yarısına qədər istifadə edilən bir tituldur. Türkcə "inanmaq" felindən yaranmışdır. Sürəkli olaraq hökmdarın məiyyətində olan, onun ən yaxın dostu və müşaviri sayılan, ən çox güvəndiyi şəxslərə verilən bir tituldur *(A.Taşağıl. İnak // TDVİA, cilt: 22, yıl: 2000, s.255-256).*

[1176] Bəzi digər mənbələrdə Buman və ya Noyan.

[1177] Qəbəsi (Kabesi) – Xarput yaxınlığında bir yaylaq *(Öztürk, şərhlər, s.436).*

- Qara Yusifin nökərlərindən olan Pir Ömər eşitdi ki, Qara Osman böyük bir qələbəliklə savaşa gəlir. O, əsla qorxmadı və yerindən dəbərmədi (qaçmadı). Elə ki ordu göründü, onları qarşılama tələsdi, mərdanə döyüş apardı və igidcəsinə həmlələr etdi. Axırda da öldürüldü. İndi Cahanşah padşahın elə əmirləri var ki, igidlikdə və səviyyədə özlərini Pir Ömərdən daha üstün bilirlər. Ona nə olub ki, bir yalan xəbərdən ötrü iztiraba düşüb? Böyüklər demişlər ki, sabit fikirli adam, küləyin əsməsi ilə söyüd yarpağı kimi yerindən oynayan adam deyildir, qərarını və təmkinini tərk etməyən adamdır.

Beyt

Əgər ayıq-sayıqlar kimi qətiyyət yolu ilə getsən,
Lazım deyil ki, hər küləkdə söyüd yarpağı kimi titrəyəsən.

Bir halda ki yürüş xəbəri yalan idi, yalançıları qətlə yetirmək gərək idi.

Sonra yenə söylədi:

- Mən necə öz oğullarımı onun dərgahına göndərə bilərəm ki?! Axı Cahanşahın başlıca məşğuliyyəti əxlaqsızlıq və pozğunluqdur. O, əmirlərin oğullarına təcavüz edir. Yaşının çoxluğuna və səltənət mənsəbinə baxmayaraq, əlində şam tutur ki, başqaları bir-biriləri ilə homoseksual (livatə) əlaqəyə girsinlər. Sultanların xüsusiyyətlərindən hansı biri onda var ki, özünü sultan adlandırır? O, bütün gecəni oyaq qalır və gündüzlər yatır, "Biz gecəni (hər şeyi bürüyən) örtük etdik, gündüzü isə dolanışıq (ruzi qazanmaq) vaxtı etdik"[1178] buyruğunun əksinə rəftar edir. Ona görə Rum padşahı Sultan Məhəmməd onu "yarasa" adlandırmışdır. O, fəryad edən kimsənin dadına yetməmişdir.

Daha sonra dedi:

- Məhəmmədi mirzə bir çörəkçi qızından doğulmuşdur; axı onun nə hünəri ola bilər?![1179]

Axırda Qazı Əlini layiqli töhfələr və müvafiq peşkəşlərlə Cahanşah padşahın dərgahına göndərdi. Bu xəbər alinəsəb padşaha çatdıqda, adam göndərib Qazı Əlini geri qaytardı və peşkəşi qəbul etməyib bildirdi ki, "sülh işinin baş tutması yalnız Həsən bəyin və ya onun oğullarından birinin gəlişinə bağlıdır". Hərçənd xeyirxahlar ərz etdilər ki, "Həsən padşahın bizimlə söhbəti ox kimi düzdür və onun savaşmaq, vuruşmaq fikri yoxdur". Lakin Cahanşahın qəzəb alovu elə alışmışdı ki, onun şölələrini öyüd-nəsihət suyu ilə söndürmək mümkün deyildi. O, ildırım və şimşək kimi gurlayıb coşurdu. Müxtəlif bölgələrə bukavullar göndərib qoşunlarını çağırdı. Fərmana əsasən, Məhəmmədi mirzə İsfahandan, Əbu-Yusif mirzə Şirazdan gəldilər, digər İraq və Fars hakimləri də bir-birinin ardınca Cahanşahın Keyvan şövkətli ordusuna qoşuldular. Cahan padşahı (Cahanşah) ailəsini və köçünü Azərbaycan qışlağına yolladı, özü isə hərəkət bayrağını Diyarbəkr tərəfə qaldırdı.

Bu xəbər Həsən padşaha çatdıqda, fikir və əndişə ordusu onun könlünü istila etdi. O, cəld adamlar göndərib Ağqoyunlu ordusunu çağırdı. Qardaşı Cahangir mirzə öz oğulları Murad bəy və İbrahim bəylə birlikdə Həsən padşahın ordusuna qoşuldu. Qəribə və lətif işlərdən biri bu idi ki, asimani kəramət kitabından ("Quran"dan) fal açdılar. "Fironun yanına get! O, həqiqətən, azğınlaşıb həddini aşmışdır"[1180] ayəsi çıxdı. [Həsən padşah] röya aləmində belə gördü ki, Cahanşah padşah başına köhnə bir papaq qoyub, əlində çahartar tutaraq qarşısında rəqs edir.

Həmin zaman [Həsən padşah] İsgəndər Piltəni səf yaran bahadırlardan [ibarət] bir dəstə ilə dil tutmağa göndərdi. Onlar Şeyx İdris məqamında[1181] Cahanşah padşahın qaravullarına çatıb döyüşə girdilər və onlardan bir neçə nəfəri qətlə yetirdilər. Birini də tutub dərgaha yolladılar. Əsir bildirdi ki, "Cahanşah padşah məiyyəti və ordusu ilə Ərcişdən keçərək, köçhaköçlə irəliməkdədir". Ona görə də Həsən padşah köç edib Bilqeysi[1182] təkyəsinin qapısında dayandı və ordugahın dörd tərəfinə sədd çəkdirdi. Ağqoyunlu camaatı o şövkətli ordunun (Cahanşahın ordusunun) qorxusundan dəstə-dəstə qaçmağa başladılar. O həzrət oğullarını göndərib, onları tutaraq cəzalandırdı və bəzilərinin burunlarını deşdirdi.

---

[1178] *Qurani-Kərim, "Nəba" surəsi, 10-11-ci ayələr.*
[1179] Uzun Həsənin Qaraqoyunlu elçisi ilə söhbətinin təfərrüatı üçün bax: *Əbu-Bəkr Tehrani. Kitabi-Diyarbəkriyyə (Bakı nəşri), s.218-221.*
[1180] *Qurani-Kərim, "Taha" surəsi, 24-cü ayə.*
[1181] Əxlat və Muş arasında yerləşir *(Nəvai, şərhlər, s.669).*
[1182] "Kitabi-Diyarbəkriyyə"də Məlğisi *(Nəvai, şərhlər, s.669).*

Cahanşah padşah da çoxsaylı bir ordu və şövkətli bir güruh ilə Muş səhrasında cah-calalla dayandı və oradan köç edib Çapaqçur səhrasında[1183] yerləşdi. O, İbrahim şahı göndərdi ki, oranın qalasını nəzərdən keçirib geri qayıtsın. Adı çəkilən əmir Fərat çayından keçib, qalanı mühafizə altına alaraq orduya geri döndü. Bu xəbər Həsən padşaha çatdıqda Sultan Xəlili, Söhrab bəyi, Yusif bəyi, Şeyx Həsən bəyi və Xurşid bəyi iki min cavanla qaravulluğa göndərdi. Onlar Çapaqçur ətrafında Yəzd və Tarom valisi Qasım bəy Pərvanəçiyə rast gəlib vuruşdular və qüdrətli dövlətin gücü ilə qalib gələrək onun mülazimlərindən səksən nəfəri qətlə yetirdilər, altmış nəfəri isə əsir tutdular. Sözügedən Qasım bəy yüz həsrət və ahla Cahanşahın ordusuna qayıtdı.

Beyt

“Ordu oldu sərkərdənin önündə xəcil,
Sərkərdə də öz bəxtindən utancaq”.

Cahanşah həmin əhvalat üzündən son dərəcə qorxaq-hürkək olub, Əntur mövqeyində qalaraq dərgah əmirləri və ordu başçıları ilə məşvərət etdi. Onlar dedilər:

- Bu qış Azərbaycan qışlağına yollanaq. Əgər onların üstünə getsək, qarın çoxluğundan və soyuğun şiddətindən yolumuz bağlanar. Buna görə də geri dönək ki, qışın sərxoşluğu sınsın, şaxtanın hakimiyyəti yox olmağa üz qoysun, dağın və çölün havası mülayimləşsin. Baharın əvvəllərində, gecə-gündüz bərabərliyi zamanı Həsən bəyi məhv edib ortadan qaldırmaq üçün yola düşərik.

Ona görə də o həzrət həmin yerdən köç edib bir dağın ətəyinə gəldi və oradan da köçüb Səncəq mövqeyində dayandı. Ordunun, yüklərin və əşyaların əksəriyyətini yola saldı. Özü isə oğulları və əmirləri ilə qəflət yuxusuna gedib bu beytin məzmunundan xəbərsiz qaldı:

Beyt

“Belə xəbərsiz yatmaq lazım deyil,
Çünki qəflətən bir sel gələr qapıdan”.

Digər tərəfdən Həsən padşah, Cahanşah padşahın geri dönməsindən xəbərdar olduqda, öz adamlarını toplayıb məşvərət etməyə başladı. Onların əksəri dedilər:

- Dövlət üçün faydalı olan budur ki, Həmid tərəfə qayıdaq və onu narahat etməyək.

Həsən padşah dedi:

- Cahanşah nadan, dünya malına düşkün, xəzinəsi və ordusu ilə lovğalanan, taxt-tacı ilə şadlanan bir adamdır. Cin və insan şeytanları nəfsani şəhvətləri və cismani ləzzətləri onun təbiətinə hopdurmuşlar. O, gecə-gündüz şərab içir və dövlət sahiblərinə lazım olan ehtiyatkarlığı tərk etmişdir. Bizim ondan əsla qorxumuz yoxdur.

Əmirlər onun sözünü razılıq qulağı ilə qəbul etdilər (sözü ilə razılaşdılar). O gecə Həsən padşah altı min süvari ilə səddən (istehkamdan) çıxıb müxaliflərin ilk yurduna çatdıqda, zəfər nişanlı əsgərlərin qaravulları gəlib məruzə etdilər ki, “Cahanşah öz köçünü yola salmışdır və özü bəzi yaxınları, oğulları, nədimləri və peşəsi şagirdlik olanlarla[1184] bir yurdda qalmışdır; fürsət qənimətdir”.

Elə ki bu xəbər ali [hökmdarın] qulağına çatdı, o həzrət təcrübəli adamlar və dövranın igidləri ilə birlikdə müxaliflərin üzərinə getdi. İzdihamlı qoşunlar günün günorta çağı qəflətən külbaş düşmənlərin üstünə tökülüşdülər. İki tərəfdən qılınca və oxa əl atdılar. O tədbirsiz padşah can qorxusundan bir yük heyvanına minib qaçış yolunu tutdu.

Şeir

“Asayiş ortadan qalxdı, qiyamət aşkar oldu.
Əcəl toru zirehlərə döndü, ömür ipinə düyünlər vuruldu”.

Ləl rəngli qanın əksindən mavi səma və Bəhramın yaşıl xəncəri qırmızı rəng aldı. Yerin yaşıl örtüyü qızardı. Fələk tutilərinin qanadları qırmızı söyüd rənginə döndü.

Nəzm

“Tozanaq içində çeşmə gizləndi,
Çubuqlar içində çərxi-fələk qurdu çənbər.
Yer üzü təlatümlü qan dənizinə çevrildi,

---

[1183] Türkiyənin Bingöl bölgəsindədir.
[1184] Şagird-pişəgan – yəqin ki, burada təcrübəsiz əsgərlər nəzərdə tutulur.

Orada süvari gəmi idi, ölü isə lövbər.
Əcəl hər tərəfə avar çəkirdi,
Qan içində üzən bir adam kimi”.

Həsən padşahın heybətindən o şövkətsiz güruhun bədəninə titrəmə düşdü və onların hamısı özlərinin Cəmşid kimi iqtidarlı padşahını (Cahanşahı) təqlid edərək qaçış yoluna çıxdılar. Məchul bir adam arxadan Cahanşaha çatıb, ona bir yara vuraraq əsir tutdu. Cahanşah öz qatilinə söylədi:

- Məni öldürmə! Məni Həsən padşahın hüzuruna apar! Bunun sənə faydası olacaq.

O şəxs qəbul etməyib onu qətlə yetirdi və narahat oldu ki, əgər Həsən padşah bundan xəbər tutarsa, ona əziyyət verər. Ona görə də bu sirri kimsəyə demədi. Ertəsi gün car çəkdilər ki, “hər kəs ondan (Cahanşahdan) xəbər verərsə, padşahlara layiq bir mükafata layiq görüləcəkdir”. Qatil ənam ümidi ilə Cahanşah padşahın başını fələyin yuva saldığı astanaya gətirdi. Onun bədənini də tapdılar. Başını Xorasan tərəfə, Sultan Əbu-Səidə göndərdilər.

[Cahanşahın] oğullarından Məhəmmədi mirzə və Əbu-Yusif mirzə əsir alındılar. Qətlə yetirilmiş əmirlər arasında divan əmiri Pirzad bəy, tuğaçı Rüstəm bəy Alpavut, Lələ Səfərşah, Qurmişi, Yəzd valisi Qasım Pərvanəçi və Əmənoğlu Hüseyn vardı. Onların hamısı tuğ və nağara sahibi, tümən və minlik sərdarı idilər. Bunlardan başqa, əmirzadələrdən İsgəndər Şahsüvar, Qılıc Aslanın qardaşları, onun bir oğlu, İsgəndər Duxarlu, Qayıtmış Əmiraxur, Bayəzid bəy Kürd, Kor Lələ, Şahvəli Baharlu, Zal və digər inaqlar, qoşun əmirləri, hökmdar məclisinin müqərrəbləri, adlı-sanlı cavanlar qətlə yetirildilər. Əbülhəsən Tərxan, Şeyx Bəhlul və Pir Məhəmməd Alpavut əsir alındılar.

Həsən padşah, Cahanşahın çadırında qərar tutdu və onun bəzi adamlarını Məhəmmədi mirzə ilə birlikdə qətlə yetirdi. Yusif mirzəni isə həbsdə saxladı. Əsgərlərin əlinə düşmüş Yadigar Məhəmməd ibn Sultan Məhəmməd ibn Baysunqur ibn Şahrux padşahı himayə etdi. Pir Əli Əlişəkər, Söhrab Tərxan və Pir Məhəmməd Alpavut kimi bəzi əmirlərə hörmət göstərib onları azad etdi. Qəzavü-qədər kimi cərəyan edən fərman verildi ki, “say-seçmə və sadə adamlardan heç kim təcavüz qılıncını intiqam qınından sıyırmasın və təvəqqe əlini onların canına, malına və arvad-uşağına uzatmasın; o camaatın sağ-salamat öz məskənlərinə və məkanlarına qayıtmasına imkan yaradılsın; müxalif qoşunu təqib edilməsin; qadın və kişilərdən ibarət zəiflərə yol azuqəsi verilib öz diyarlarına doğru yola salınsınlar”. [Həsən padşah] havanın soyuqluğu, qarın və soyuğun çoxluğu üzündən Amid tərəfə qayıtdı və həmin qış orada qışlaq etdi. Cahanşahın əmirlərinə, şəhərlərin daruğalarına və Bağdad vilayətindəki kürdlərin qalalarına nəvaziş məktubları göndərib onları öz tərəfinə [keçməyə] dəvət etdi. O, Xəlil ağanı Sincara yolladı. Mosul da ələ keçirildi. Sincar hakimi Şahəli aləmin mehvəri olan dərgaha gəldi və Ərbil də ona verildi. Pir Məhəmməd Alpavutun elçisi tabeçilik izharı ilə Bağdaddan dərgaha gəldi. Ona görə də [Həsən padşah] Uğurlu Məhəmmədi iki min cavanla qışın əvvəllərində Bağdada göndərdi. Pir Məhəmməd müxaliflik etməyə başladı.

Cahanşahın qətli ucbatından İranın bölgələrində böyük bir fitnə üz verdi. Təbrizdə [əvvəlcə] Mirzə İsgəndərin övladları, daha sonra isə Cahanşah mirzənin oğlu Həsənəli, Sultaniyyədə Şahmənsur Şahsüvar, Taromda Zeynalabidin Şeyx Hacı İraqi Gilan əmirlərinin yardımı və köməyi ilə, Qəzvində Karkiya Sultan Məhəmməd Lahicinin əmirləri, Reydə və Xəvarda[1185] Rüstəmdar əmirləri və Çəlavilər, Qumda şəhər daruğası Şahvəli Quz baş qaldırdılar. Cahanşahın oğlu Əbülqasım mirzə Kirmandan Azərbaycana qoşun çəkdi. Xorasandan və Mavəraünnəhrdən Sultan Əbu-Səid İraq və Azərbaycanı ələ keçirməyə yollandı. İnşallah, onların əhvalatını daha sonra qeyd edəcəyik.

Amma Cahanşah padşah Səncəq mövqeyində qətlə yetirildikdən sonra Sarban Qulu məğlubların bəzisi ilə Təbrizə gəldi. Alçaqlardan və əclaflardan [ibarət] bir dəstə onun yanına toplandı. Onlar şəhərin sahibinə çevrildilər. O əsnada Qara Yusif oğlu Mirzə İsgəndərin qızları Arayiş bəyim və Şahsaray bəyim baş qaldırdılar. Məğlub ordu onların hakimiyyəti altına keçdi. Sarban Qulunu tutdular və qurbanlıq dəvə kimi para-para etdilər. Arayiş bəyim qadın zinətlərini döyüş alətləri ilə əvəz edib səltənət taxtına əyləşdi. O, Əmir Şahməhəmməd Gavərudiyə divan əmiri [vəzifəsi] verdi, Əmir Əlaəddin Sədiq Keçəçini[1186] isə vəzirliyə təyin etdi. Tənhalıq guşəsinə çəkilmiş qardaşı Hüseynəlini [oradan] çıxarıb onun adına xütbə oxutdu. Sultan Əbu-

[1185] Xəvar – İranda, Rey şəhərindən 115 km. şərqdə, Reylə Simnan arasında yerləşən şəhər.
[1186] Əmir Əlaəddin bundan öncə Cahanşah tərəfindən həbs edilmişdi *(Nəvai, şərhlər, s.675).*

Səidin yanından elçi kimi gəlmiş Əli bəy Cağataya da ehtiram göstərdilər və xütbədə sultanın da adını çəkdilər.

Bu xəbər Xoyda Cahanşahın hərəminə və qızlarına çatdıqda, onlar köç edib Marağa tərəfə getdilər. [Cahanşahın arvadı] öz qardaşları Qasım və Həmzəni padşahın bir qızı ilə Təbrizə göndərdi. Bu xəbər Arayiş bəyimə çatdıqda onları qarşılamağa tələsdi. İki dəstənin bir-birinə yaxınlaşması qarşıdurma ilə nəticələndi. [Arayiş bəyimin adamları] qılınc və nizə işlətmədən fərar etdilər. Arayiş bəyimin qardaşı Sahibabad ətrafında öldürüldü. Arayiş bacısı ilə birgə əsir düşdü. Həmzə şəhəri qarət etdi və Cahanşahın qızı ilə birlikdə Marağaya tərəf yola düşdü.

### Cahanşahın oğlu Həsənəlinin səltənəti haqqında söhbət

Bədbəxt Həsənəli atasına qarşı tüğyan və üsyan etdiyi üçün iki il idi ki, Maku qalasında məhbus idi. Atasının qətli və Mirzə İsgəndər övladlarının baş qaldırması xəbərini eşitdikdə o, qaladan çıxdı və bir neçə gün orada qaldı. Ona iki-üç min nəfər adam qoşuldu. Ondan sonra Təbrizə daxil oldu. O əsnada Şah Hacı bəy Gavərudi və qardaşı Şah Məhəmməd, Qılıc Aslanın oğlu Seydi Qasım və Hacı Həsən Ağacəri, Həsənəlinin xidmətinə gəldilər. Gündən-günə əsgərlər hüsn-rəğbət ümidi ilə dəstə-dəstə ona qoşuldular. Axırda onun əsgərlərinin sayı iki yüz minə çatdı. Əlincəq qalasının kutvalı Yaqub Çöhrə, [Həsənəlinin] atasının (Cahanşahın) xəzinələrini onun hüzuruna gətirdi. Uzantu[1187] qaladarları da xəzinələri təslim etdilər. Həsənəli təqribən yüz əlli min Təbriz tüməni məbləğində qızılı, gümüşü və qumaşları nökərlərinə payladı. O, atasına qarşı müxaliflik etdiyi vaxt çöllərdə onunla sərgərdan gəzən adamları özünə məhrəm (ən yaxın adam) etdi və onlara "çöllü" adı qoydu. Əmir Səid Aşuru və Əmir Əlaəddin Sədiq Keçəçini vəzirliyə təyin etdi. Mirzə Pirbudağın vəziri Əmir Məcdəddin İsmayıl Şirazini də onlara həmkar etdi. Həsən padşahın əmisi Mahmud bəy Ağqoyunlunu divan əmiri etdi. Şah Hacı bəy Gavərudini Cəmşid bəy Ağqoyunlu, Hacı Həsən Ağacəri, Lələ Səfərin oğlu Şahqulu, Dini bəy Cağatay və Cahangir kimi əmirlərdən bir neçə nəfərlə birlikdə beş min yaraqlı süvari ilə İraqı zəbt etməyə göndərdi. O, hər şəhərə bir əmir təyin etdi. Təfsilatı belədir ki, Qumu – Şah Hacı bəyə, İsfahanı – Məhəmmədi bəyin oğlu üçün mühafizə etməkdən ötrü Dini bəyə, Qəzvini – Hacı Həsənə, Nətənz və Cürbadəqanı – Şahquluya verdi. Cahanşah padşahın arvadı və onun digər oğullarının anası olan Xatuncan bəyimi əhd-peyman verərək, Əmir Nemətulla Sanini[1188] göndərərək, Cuşin qalasından gətirib qətlə yetirdi. Xatuncan bəyimin qardaşları Həmzə və Qasıma da eyni şərbətdən içirdilər (öldürdülər).

### Ölümlər

Bu il Seyid Kəmaləddinin oğlu Seyid Zeynalabidin igidlik göstərən bahadırlardan [ibarət] bir dəstə ilə Seyid Abdullanın üstünə gəlib onu hamamda qətlə yetirdi. O, Mazandarandan Həsən padşaha yüz iyirmi xərvar ipək vergi verməyi qəbul edərək Mazandaranda yerləşdi[1189]. Həmin zaman Gilan valisi Karkiya Sultan Məhəmməd, Seyid Əbdülkərimi çoxlu ordu ilə Mazandarana göndərdi. Mir Zeynalabidin onlara məğlub olub Həzarcəribə getdi və o diyarda məskunlaşdı.

Cahanşah padşah ibn Qara Yusif ibn Qara Məhəmməd ibn Törəmiş ibn Bayram Xoca bu il qətlə yetirildi. Cahanşah sitəmkar, dikbaş, zalım, qəddar və Firona bənzər bir padşah idi.

Beyt

"Cahanı yandıran, rəhmsiz və tiran (xirəkoş),
Üzünün turşluğundan cahanı turşudan".

O, həmişə eyş-işrətə meyilli idi.

Nəzm

"Məclisi huriləri və qəsrləri qısqandırırdı,

[1187] Bəzi qaynaqlarda Urantu kimi yazılır *(A.A.Arayancan. Karakoyunlu hükümdarlarından Cihanşah ve dönemi. Doktora tezi. Ankara Üniversitesi Sosyal Bilimler Enstitüsü, 2010, s.188).*

[1188] Əmir Seyid Nemətulla Sani – Nemətullahiyyə sufi təriqətinin qurucusu Şah Nemətulla Vəlinin oğlu Şah Xəlilullanın oğludur. Qaraqoyunlu Cahanşah öz qızı Xanımı ona ərə vermişdi *(Nəvai, şərhlər, s.678).*

[1189] Seyid Zeynalabidin və Seyid Abdulla Mazandaran hakimlərindən olan Mərəşi seyidləri xanədanına mənsub olub, əmioğlu idilər. Seyid Abdulla, Seyid Zeynalabidinin atasını ömrünün sonuna kimi zindanda saxlamış, Seyid Zeynalabidin də 5 rəbiüləvvəl 872-ci ildə (04.10.1467) onu öldürməklə bu əməlinin intiqamını ondan almışdı *(Nəvai, şərhlər, s.679).*

Hüzur və şadlıq eyş-işrəti ilə zinətlənmişdi.
O məclisdə həmdəm və nədim idi,
Sağlam təbiətə malik kimsələr.
Görməmişdir ömründə qəm üzü bir dəm,
Getməmişdir onun üstünə zəmanədən sitəm.
Nə qış ona əl uzada bilməmişdi,
Nə də yay istisindən bir kədəri və dərdi vardı.
Hər gün qəflət yuxusunda idi,
Hər gecə eyş-işrətdə idi.
Nə [İlahi] divandan və dərgahdan çəkinirdi,
Nə də səhər vaxtı yüksələn ahlardan qorxurdu.
Bir anda onun cah-calal aynası,
Məzlumların ahı ilə qaraldı.
Onun dövründə işi pozulmuş fəqirlərin gözündən,
Bəs deyincə yaşlar axdı.
Bir anda bunlar toplanıb sel oldu,
Onu kökündən qoparıb dənizə və düzə apardı.
Zülmlə çox adamın qanını içsə də,
Bu qanlar yüz qüssə ilə onun boğazından töküldü.
Yetərincə mal yığsa da, nə faydası?!
Onları (malları) atdı və düşməni götürüb apardı”[1190].

Amma alimlərə və şairlərə ehtiram göstərirdi və özü də şeir deyirdi. Təxəllüsü “Həqiqi” idi. Öz şeirlər divanını Mövlana Camiyə göndərmişdi. Mövlana onun cavabında bu beytləri göndərmişdi:

Şeir

“Hökmdarın inci qutusu kimi kitabı,
Həqiqi gövhərlərlə dolu halda gəlib çatdı.
Orada həm qəzəl var, həm məsnəvi,
Həm maddi sirlər var, həm mənəvi.
Hər qəzəlin mətləsi doğubdur,
Əzəl sübhünün aydın parıltısı kimi.
Məqtəsinə nə deyim ki, hər məqtəsi,
Əbədi feyzin mənbəyi idi.
Məcaz küçəsinin surətpərəstlərinə,
Həqiqi şahdan nişan verib yenidən”.

Ömrünün müddəti altmış dörd il, səltənət əyyamı otuz il olmuşdur. Məmləkəti Azərbaycan, İraqi-Ərəb, İraqi-Əcəm və Fars idi. Onun altı oğlu vardı: Mirzə Pirbudaq, Həsənəli, Məhəmmədi mirzə, Əbu-Yusif mirzə, Əbülqasım mirzə, Fərruxzad mirzə.

Əsərlərindən biri cənnət nişanlı Təbriz şəhərində yerləşən uca təməlli məsciddir[1191]. Heç kəs belə pərgarlıqda bir binanı nişan verə bilməz. Onun yüksək tağı qarşısında göyün yeddinci qatının rəvağı alçaqdır və eyvanının şəmsəsinin (bəzəyinin) müqabilində asimanın günəşi aşağı dərəcəlidir.

Şeir

“Hündür tağı fələklə cüt olubdur,
Fələk ona mail olmuş gizlində.
Onun qübbəsi çərxi-fələyin üstünə çıxmış,
Döşəməsindəki xalça göyün yeddinci qatınadək uzanır”.

[1190] Bu şeirə bir qədər fərqlərlə “Kitabi-Diyarbəkriyyə”də rast gəlirik (əsərin Bakı nəşrinə baxa bilərsiniz: s.226-227).
[1191] Təbrizdəki Göy məscid nəzərdə tutulur.

Məscidə birləşik şəkildə mükəmməl gözəllikdə və yüksəklikdə bir günbəz ucaldılmışdır. Mahir mühəndislər və dəqiq naqqaşlar o günbəzi qəribə naxışlarla və qızılla bəzəmişlər. O məscidə çoxlu əmlak vəqf olunmuşdur.

Şeir

“Onun sorağı Qafdan Qafa yayılmış,
Qafdan Qafa qədər vəqfləri vardır.
Sakinləri rifah halındadırlar,
Dövranın qəmindən asudədirlər.
Nə istəsələr, qüsursuz və əskiksiz,
Çatar [onlara] tərəddüdsüz hüzurla”.

Onun [ölüm] hadisəsinin tarixi haqqında demişlər:

Nəzm

“Mülk tutan Şah Cahanşah öldürüldü,
Yer üzündə o, cahanın sahibi idi.
O öldürüldü və cahan xarab oldu onun ölümündən,
Ölümünün tarixidir “cahanın xarablığı”[1192].

Bir başqası da [belə] demişdir:

“Cahanşah Bahadır Noyanın ordusu,
Bütün təchizatına, üstünlüyünə və arxa-dayağına baxmayaraq,
Rəbiüssani ayının 12-də (10.11.1467) viran qaldı,
Və tarixi “Həsən bəy öldürdü”[1193] oldu”.

[Yuxarıda] qeyd edildiyi kimi, Cahanşahın oğlu Məhəmmədi mirzə də bu il öldürüldü. O, on dörd il İsfahanda hökm sürmüşdür və rəiyətə münasibətdə zülm, sitəm, cövr və cəfa etmişdir. Onun könlündə ədalət və insaf əlamətlərinə, mərhəmət və şəfqət adətlərinə yer yox idi. O, qayğıkeşliyi cinayət və günah sayardı. O, gecə-gündüz öz vaxtını zülmə, pozğunluğa və əxlaqsızlığa sərf edərdi. Həmişə onun bütün səyləri eyş-işrətə, haramlara, günah işlərə və nalayiq əməllərə yönəlmişdi. O, rəzilləri vali və ali edərdi. Axırda isə onları tutub mallarını müsadirə etdikdən sonra qətlə yetirərdi. [Həmin malların] bəzisini şəhər və vilayət əhlinə satardı. Füqəradan yüz tümən, iki yüz tümən alar, onları da qətlə yetirərdi.

## 873-CÜ İLDƏ (22.07.1468 – 10.07.1469) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Həsən padşahın Azərbaycan tərəfə qoşun çəkməsi və Cahanşahın oğlu Həsənəli Türkmanın məğlubiyyətə uğraması

Ulduzlar hökmdarı (günəş) bahardakı gecə-gündüz bərabərliyi nöqtəsinə çatdıqda söyüd o həzrətin dövlətinə qarşı müxaliflikdən dəm vuran düşmənlərin qəsdinə iti xəncər çəkdi, süsən müxaliflərə tənə etmək üçün dəşnə kimi dilini itilədi, ildırımın parıltısı mübarizlərin qılıncının cövhəri kimi dalğalanmağa başladı və baharın çarpaz şimşəyi “Onların üzərinə möhkəm daşlar atan qatar-qatar quşlar (əbabil quşları) göndərdi”[1194] tüstüsünü Qaraqoyunlu camaatının üstünə yağdırmağa başladı. Baharın əvvəllərində ali mənşəli padşah (Uzun Həsən) Diyarbəkr qışlağından çıxıb hərəkət bayrağını Bağdada doğru qaldırdı. Yol əsnasında Mosulu, Sincarı və Ərbili fəth etdi.

Bağdad ətrafı ali mənşəli hökmdarın dayanacaq yeri olduqda, Pirbudaq mirzədən sonra Cahanşah padşahın fərmanı ilə o diyarın valisi olmuş Pir Məhəmməd Alpavut müxaliflik etməyə başlayıb, özünü itaət səadətindən məhrum edərək iztirab girdabına və yanlış düşüncələr Dəcləsinə saldı. Qalib qoşun (çərik) müharibəyə və mühasirəyə başladı. Mühasirə əyyamı qırx gün uzansa da, fəth üz vermədi. Ona görə də o həzrət mühasirəni tərk edib hərəkət yüyənini Azərbaycana tərəf döndərdi.

---

[1192] “Xərabiyi-cəhan” = 872 h.
[1193] “Həsən big bekoşt” = 872 h.
[1194] *Qurani-Kərim, “Fil” surəsi, 3 və 4-cü ayələr.*

Muş səhrası dəniz kimi coşan və ildırım kimi gurlayan ordunun dayanacaq yeri olduqda Həsənəlinin elçiləri aləmin pənahı olan dərgaha gəldilər və Həsənəlinin göndərdiyi məktubu təqdim etdilər. Məzmunu belə idi: "Atamın və qardaşımın qanının tökülməsindən ötrü mən fəqirin könlünə heç bir qübar qonmamışdır. Onların mənimlə atalığı və qardaşlığı mənadan xali olan zahiri bir anlayış idi. Qayğısız bir ata və mürüvvətsiz bir qardaş eynən biganədir (yaddır). Onları qətlə yetirməyiniz mənə etdiyiniz [əvvəlki] yaxşılıqların üzərinə əlavə olunmuşdur. Əgər bu səmtə gəlsəniz, mən bəndənin könlünə əsla qübar qonmayacaqdır".

Bu əsnada Həsənəliyə çoxlu xidmət göstərmiş və padşah olacağı təqdirdə onun tərəfindən bol-bol nəvaziş görəcəyinə dair vəd almış Sultan Mahmud Hacılu özü xahiş etdiyi üçün Həsən padşah onu elçilərlə birlikdə Həsənəlinin yanına göndərdi. Onlar Həsənəlinin ordusuna çatdıqda əmirlər Həsənəliyə dedilər ki, "əgər padşah icazə versə, biz bu elçini yanındakı otuz nəfər nökərlə birlikdə qətlə yetirək və Həsən padşaha aydın olsun ki, biz ona tabe olmayacağıq". Ona görə də Həsənəli onları əmirlərə təslim etdi. Əmirlər Sultan Mahmudu otuz nəfər nökəri ilə birlikdə qətlə yetirdilər[1195].

Xoy bölgəsinin ərazisi alinəsəb padşahın dayanacaq yeri olduqda xəbərçilər ərz etdilər ki, kürdlərdən [ibarət] bir dəstə Həsənəlinin dərgahına yönəlmişdir. Ona görə də o həzrət (Həsən padşah) Sufi Xəlil Mosullunu həmin camaatı dəf etməyə göndərdi. Adı çəkilən əmir onları ələ keçirib aləmin pənahı olan dərgaha yolladı. Ali hökm verildi ki, onların gözlərini kəllələrindən oyub çıxarsınlar. O yandan Həsənəli Türkmankəndindən[1196] tədricən Mərəndə gəlib öz ordugahının dörd tərəfində xəndək qazdırdı. Həsən padşah öz qoşununu dəstə-dəstə Həsənəlinin ordugahı üzərinə göndərdi ki, ona basqın etsinlər. O cümlədən Satılmış Miraxur bir dəstə cəsur cavanla xəndəyin kənarına gedib Həsənəlinin bir sıra mülazimlərini qətlə yetirdi. Həsənəli zəfər şüarlı əsgərlərin qorxusundan mərkəzi nöqtə kimi ayağını xəndəkdən kənara çıxara bilmirdi. Milçəyin və heyvanların çoxluğundan onun ordugahını üfunət bürümüşdü, su və ot tapılmırdı. Həsən padşah bir mənzil geri oturdu ki, Həsənəli buna aldansın və fərar etmək üçün xəndəkdən çıxsın. Lakin Həsənəli son dərəcə qorxduğu üçün əsla xəndəkdən kənara ayaq qoymadı.

Bu əsnada Həsənəli, Şahmənsur [ibn] Şahsüvar bəyi və Əmir İbrahimşahı ordunun bir dəstəsi ilə qaravulluq etməyə göndərdi. Onlar vəfasızlıq yolu ilə gedib Həsən padşaha qoşuldular. Bu xəbər Həsənəliyə çatdıqda onların yaxınlarını qətlə yetirib, böyük əmirlərdən Savalan bəyi və Əli paşanı da [ölümlə] cəzalandırdı (yasağa çatdırdı).

Amma ordugah bir-birinə qarışdı. Bəziləri Həsən padşahın hüzuruna getdilər. Bir dəstəsi isə Sultan Əbu-Səidin ordusuna yollandılar. Yurdda (düşərgədə) təxminən otuz min çadır qaldı və iki gün boyunca həmin yurd Şəddadın behişti kimi boş qaldı. Ondan sonra Həsən padşahın əsgərləri [oranı] qarət etdilər. Həsənəli Bərdəyə qaçdı. Piri Qaramanlının oğulları istədilər ki, onu həbs edib Həsən padşahın dərgahına göndərsinlər. Lakin axırda peşman olub ondan əl çəkdilər. O, özünü Ərdəbilə yetirib Sultan Əbu-Səidin ordusuna yola düşdü.

Həsən padşah, Uğurlu Məhəmmədi Cuşin tərəfə, Yusifi isə Sərab tərəfə göndərdi. Ordugahda həbsdə olan Əbu-Yusif mirzəyə mil çəkdirib (kor edib) Təbriz tərəfə göndərdi ki, atasının məzarı üzərində mücavir olsun. Maku qalasının kutvalı, Həsənəlinin arvadını tutub dərgaha göndərdi. Həsən padşah fitnə-fəsadı sakitləşdirmək və Təbriz sakinlərinin könlünü almaq üçün Sultan Xəlili [Təbrizə] yolladı.

Xoy mövqeyində xəbər çatdı ki, Şahəli bəy Pornak Əlincəq qalasını fəth etmişdir. Seyid Məzid Ərğun tərəfindən mənqəlay olan cağatay daruğası bu xəbəri eşitdikdə, hakimiyyətdən əl çəkməyərək vəziyyətin nə yerdə olduğunu Əmir Seyid Məzid Ərğuna bildirdi. Həmin zaman Təbrizin iki mənzilliyinə çatmış olan Əmir Seyid Məzid, Sultan Əbu-Səidin ordusuna yollandı. Onlar birlikdə Miyanəyə hərəkət etdilər. Həsən padşah, Sultan Əbu-Səidin yürüşündən xəbərdar olduqda Sultan Xəlili Təbrizdən geri çağırdı.

---

[1195] "Kitabi-Diyarbəkriyyə"dən bəlli olur ki, bu elçinin əsl məqsədi casusluq idi *(Nəvai, şərhlər, s.686)*.

[1196] Türkmankəndi – Cənubi Azərbaycanda, Miyanə şəhərindən qərbdə, Təbriz – Zəncan yolu üzərindəki indiki Türkmənçay kəndidir.

**Sultan Əbu-Səidin Xorasandan Azərbaycana gəlməsi və onun Həsən padşah Türkmanın əli ilə öldürülməsi haqqında**

Azərbaycan hökmdarı Mirzə Müzəffərəddin Cahanşah Türkman Diyarbəkrdə qətlə yetirildiyi zaman Sultan Əbu-Səidin tərəfindən elçi kimi Təbrizə gəlmiş Əli bəy Cağatay Xorasana qasidlər göndərdi. Cahanşah 12 rəbiüssanidə (10.11.1467) öldürülmüşdü. Bu xəbər 3 cəmadiyülaxırda (30.12.1467) Mərvdə Sultan Əbu-Səidə çatdı. Ona görə də üfüqlər hökmdarı qışlaq yurdundan Azərbaycana və İraqa yürüş etmək əzmi ilə hərəkətə gəldi.

Şeir

“Kosdan gurultu və nərə qalxdı,
Elə bir nərə ki, ondan sərsəm oldu div.
Nağaranın hay-küyündən ay qulaq tutdu,
Ordunun tozundan günəş yolunu itirdi”.

Ali əmr verildi ki, Damğan daruğası Əli Cəlair, Simnan valisi Seyid Məhəmməd Həzarcəribi və Səbzəvar daruğası Məhəmmədyar qələbə şüarlı əsgərlərin hərəkətindən öncə o diyara getsinlər. Fərmana əsasən, onlar böyük bir ordu ilə Vəraminə gəldilər. Cağatay ordusunun hücumunun dəbdəbəsi İraqda və Azərbaycanda yayıldı. İraq əhli illər boyunca türkmanların zülmünün və sitəminin tapdağı altında qalmışdı. Axırda dərdlilərin zəhərli qarğış oxları hədəfinə çatmış, [Cahanşahın] dövləti zillət torpağına düşmüş, tacı, taxtı və cah-calalı yanmışdı. Onlar cağatayların gəlişindən şadlandılar. Əmirlər bir neçə gün sonra Savəyə yollandılar. Həsənəlinin tərəfindən o şəhərin hakimi olan Şah Hacı bəy [şəhərdən] çıxdı və əsir alındı. Əmirlər Savəni ələ keçirib oradan Kaşan tərəfə hərəkət etdilər və həmin zaman iyirmi min süvari və iki min araba ilə hökmdar ordusundan gələn Əmir Seyid Məzid Ərğuna qoşuldular. Əmir Seyid Məzid, Əbülqasım mirzənin[1197] düşərgəsinin yerləşdiyi Xərvərə[1198] tərəfə hərəkət etdi. Döyüşdən və vuruşdan sonra Əbülqasım mirzə qaçdı. Onun qoşunu dağıldı. O əsnada Mirzə Sultan Mahmud qeyri-məhdud bir ordu ilə Əmir Seyid Məzidə qoşuldu. O iki xoşbəxt bir-biri ilə ittifaq halında hərəkət bayrağını Sultaniyyə tərəfə qaldırdılar.

O əsnada xəbər gəldi ki, Həsənəli çoxlu ordu ilə Miyanəyə gəlmişdir. Elçilər göndərdilər. [Daha öncə] Həsənəli, Sultan Əbu-Səidə bir məktub yollamışdı və məzmunu belə idi ki, “İraqa üfüqlər hökmdarının (Əbu-Səidin) mülazimləri sahib olsunlar; çünki bizim Ağqoyunlularla böyük bir işimiz (münaqişəmiz) düşmüşdür və o diyarı mühafizə etməyi bacarmırıq”. [Əmirlər] bu məzmunu öz məktublarına yazıb, Həsənəlinin elçisi ilə göndərdilər və dedilər ki, “biz onun razılığı ilə İraqa gəlmişik və indi isə bu məktubda yazılanların əksinə olan hadisələr baş verir; bu vəziyyət [Həsənəlinin] Sultan Əbu-Səidə münasibətdə dostluğunun təməlini laxladacaq”.

Əmir Seyid Məzid, Səhl-Əli imamzadəsi (məqbərəsi)[1199] tərəfə qayıtdı. Sonra səs yaydı ki, “Mirzə Sultan Mahmudu Şiraza göndərirəm və geri dönməyim şahzadəni müşayiət etməyim üçündür”.

Sultan Əbu-Səid, Əmir Seyid Məzidi İraqa göndərdikdən sonra öz nəfis vücudu ilə, göydəki Süha ulduzunun gözünü deşən, göy qübbəsindəki yeddi ulduzu Sürəyya şəklinə salan, qaranlıq gecədə oxla tükü bölən və oxun ucunu tikana saplayan cəsur kamandarlarla Balıq bürcünün sonlarında ölməz və əbədi [Allahın] təqdiri ilə yola çıxdı.

Şeir

“Gözəl ceyranların hamısı hərəkətdədir,
Qara gözləri hamının canına bəladır.
Göyə qalxan atın tozanağından,
Ayın və günəşin qutusu sürmə ilə doldu.
Tatar aybənizlərinin yolunun tozundan,
Yer nafə çıxarır, asiman müşk yağdırır”[1200].

---

[1197] Əbülqasım mirzə – Cahanşahın oğlu və Uzun Həsənin kürəkəni olub, Kirman hakimi idi *(Nəvai, şərhlər, s.690).*
[1198] Xərvərə (Xərvələ) – Dərgəzin tərəfdə bir yer adıdır *(Nəvai, şərhlər, s.690).*
[1199] İmamzadə Səhl-Əli məqbərəsi – İranın Ərak şəhərindən 36 km. cənubda yerləşən Astana adlı yerdədir *(Nəvai, şərhlər, s.691).*
[1200] Nafə – ahunun göbəyindəki müşk vəzisi. Müşk – erkək ahudan əldə edilən gözəl qoxulu maddə.

Mərhələləri və mənzilləri qət etdikdən sonra Kalpuş yaylağında cah-calalla dayandılar. Həmin məkanda Əmir Qiyasəddin Mazandaranda düzəldilmiş üç min araba və piyada qoşunla hökmdarın ordusuna qoşuldu. Həmin vaxt Həsənəlinin elçisi Yarəhməd ağa Qapıçı, Əli bəy Cağatayla birlikdə [gəlib] çatdı və Həsənəlinin məktubunu təqdim etdi. Məzmunu belə idi: "Qədim düşmənimiz xanədanımıza qalib gəlmiş, dövlətimizin təməlinə böyük bir sarsıntı yol tapmış, sülaləmizin əzəmət və səadətinin Kəsra[1201] tağına açıq-aydın bir xələl üz vermiş və mərhum atamız haqqa qovuşmuşdur. İndi o həzrətin (Əbu-Səidin) ətəyinə əlimizi uzatmışıq ki, o həzrətlə atamın arasında bağlanmış qardaşlıq əhdinə əsasən, öz qayğıkeşlik və mərhəmət kölgəsini onun xələflərinin başından əsirgəməsin. Atamın qələbə ilə tutduğu bəzi məmləkətləri – İraqı və Farsı qeyd-şərtsiz [Əbu-Səidin] ali divanının ixtiyarına veririk və özümüz Həsən padşahı dəf etməyə yollanırıq. Tezliklə bu düzgün səmtə hərəkət edin ki, uzaqlıq hicabı içində gizlənmiş maddi vüsal camalı niqabsız surətdə həyat aynasında cilvələnsin".

Həsən padşahın elçiləri də bir-birinin ardınca gəldilər və ərizə gətirdilər. Məzmunu belə idi: "Bu bəndənin ata-babası fərman icraçıları zümrəsindən olmuşlar. Qara Yusifin övladları isə heç vaxt Həzrət Sahibqiranın sülaləsi ilə səmimi-qəlbdən uzlaşmamışlar. Böyük törəyə əsasən, onların kökünü qıraraq onlar tərəfdən xatircəm olmaq lazımdır".

O həzrət Kalpuş yaylağında Novruz [bayramını] qeyd etdi və Həsən padşah üçün qızıl tikişli köynək, qızıl qılınc kəməri və Novruz papağı (külahi-Novruzi) göndərərək buyurdu: "Siz çoxlu qoşunlarla o tərəfdən hərəkətə başlayın ki, bizim ordumuz da bu tərəfdən onların tamamilə ortadan qaldırmaq üçün yola çıxsın". Elçilər göndərildikdən sonra [Əbu-Səid] etimadlı adamlarını və ordu başçılarını Cahanşah padşahın vilayətlərini zəbt etməyə yolladı. Əvvəlcə dəsturi-əzəm (baş vəzir) Xoca Şəmsəddin Məhəmməd İsfahana gedib o şəhəri zəbt etdi. Əmir Qiyasəddin Əli [Farsinin] oğlu Əmir Nizaməddin Əhməd [Barlas] əmrə əsasən Şiraza yönəldi. Əmir [Cəlaləddin] Məhəmməd Barlas Kirman tərəfə tələsdi. Mir Seyid Muradın qardaşı Əmir Seyid Məhəmməd Sultaniyyəyə və Qəzvinə yola düşdü.

Ondan sonra cahan sultanı çoxlu ordu ilə Damğana gəldi və oradan Həsənəliyə və Cahanşahın digər övladlarına təziyətnamə (başsağlığı məktubu) yazıb Yarəhməd ağa ilə göndərdi. Yarəhməd ağa Türkmankəndində Həsənəlinin ordusuna yetişdi. O əsnada Sari hakimi Əmir [Seyid] Abdulla öz anasını və övladlarını yetmiş tümən [məbləğində] cavahirlə Cəmşid nişanlı sultanın dərgahına göndərdi. Həmçinin Gilan valisi Karkiya Sultan Məhəmməd asiman nişanlı dərgaha bol peşkəş yolladı. Fələk şövkətli ordu Firuzkuh[1202] yolundan keçib Çali-Külli çəmənində[1203] cah-calalla dayandı. Savuxbulağ (Soyuqbulaq) ətrafı üfüqlər hökmdarının dayanacaq yeri olduqda, Əmir Seyid Məzid Ərğunun mülazimi gəlib, Həsənəlinin ordusunun viran olması xəbərini ərz etdi. [Əbu-Səid] Qəzvin ətrafına çatdıqda, Şah Salman Deyləmi ziyafət təşkil edib bol peşkəş çəkdi. İki gündən sonra aləmi yandıran ordu köç edib yola düşdü.

Sultaniyyə qoruğu düşməni qıran qeyrətli dünya sultanının gəlişi ilə gülüstana döndükdə, Seyid Məzid Ərğunun və Təbriz ətrafındakı digər əmirlərin ərizəsi gəlib çatdı. Məzmunu belə idi ki, "ali bayraqlar tezliklə bu tərəfə gəlsinlər ki, irsi məmləkətimiz nifaq əhlinin tüğyan tikanından təmizlənsin". Onlar Həsən padşahın Əmir Seyid Məzidə əvvəlkinə zidd üslubda yazıb möhürlədiyi məktubu da göndərmişdilər. [Həmin məktubun] məğzi belə idi ki, "gərək cağatay əmirləri Təbrizdən çıxsınlar; çünki Təbrizi öz oğlum Uğurlu Məhəmmədə vermişəm".

Sultan Əbu-Səid, Sultan Məhəmməd Xudabəndəni ziyarət etməyə getdi. Günbəzə girib mücavirdən soruşdu ki, "bu qəbir kimdir?" Mücavir cavabında dedi ki, "Sultan Əbu-Səidindir"[1204]. Bu söz orada iştirak edənlərin ürəyinə işlədi. Sultan bir həftə Sultaniyyədə qaldı. O əsnada Həsənəli və Əmir Bayəzid Bistamın övladları Şeyx Cəfər Səfəvi ilə birlikdə dərgaha gəldilər. Elə həmin əsnada Həsənəlinin Sultanəli adlı on dörd yaşında oğlu atasından qaçmışdı və sultanın hüzurunda idi. O, əlahəzrətin (Əbu-Səidin) işarəsi ilə atası-

---

1201 Kəsra – Sasani hökmdarı Xosrovu bildirir. Lakin bir çox hallarda bu söz, ümumiyyətlə, hökmdar mənasında işlədilir.

1202 Firuzkuh – İranın Tehran vilayətində şəhristan. Tehranla Simnan arasında yerləşir.

1203 Bu yer Tehranın cənub-qərbində yerləşən Qar nahiyəsindədir *(Nəvai, şərhlər, s.693)*.

1204 Burada Elxani hökmdarlarından Sultan Məhəmməd Xudabəndənin və Sultan Əbu-Səidin Sultaniyyədəki məzarlarından bəhs edilir.

nın əlini öpdü. Sultan Əbu-Səid qəlbinin riqqətindən ağlamağa başladı və onu təsəlli etmək üçün şəfqətli vədlər verdi. Həsənəli də özünü [Əbu-Səidin qarşısında] oğul yerinə qoyub dedi:

- Öz atamdan heç vaxt qayğı görmədim və daim məni məhbus etdi. Üç dəfə qiyam qaldırdım, faydası olmadı. Əgər padşah bu müxlisin halına şəfqət duyarsa, bir guşədə münzəvi (tərki-dünya) olaram[1205].

Ertəsi gün sultan, Şeyx Cəfər Səfəvini görməyə getdi və uzun söhbət etdilər. Sultan Miyanəyə çatdıqda təqribən əlli min Qaraqoyunlu süvarisi bir-birinin ardınca orduya birləşdi. Əmirlərdən Əmir Əlişəkərin oğulları Pirəli, Yarəli və Bayram bəy, Cahanşah padşah zamanında Yəzd hakimi olmuş Hacı Qənbər, Həsən padşahın əmisi Mahmud bəy, Əli bəy Ağacəri, Şahəli Hacılu, Üveys İnal, Rüstəm Tərxanın oğlu Söhrab və Qılıc Aslanın oğlu hökmdar ordusuna qoşuldular. Eyni zamanda Əbu-Yusif mirzə Təbrizdən qan çəkən və yaş axıdan gözlərlə aləmin pənahı olan dərgaha gəldi. Sultan ona böyük hörmət göstərib qərara aldı ki, Təbrizdə atasının qəbri üzərində[1206] mücavir olsun və [oranın] bütün vəqflərinin touliyyəti[1207] ona həvalə edilsin.

O zaman Həsən padşahın qardaşı oğlu Murad bəy Cahangir oğlu elçi kimi Miyanədəki fələk şövkətli orduya gəldi. Bəzi tarixçilər[1208] Murad bəy yerinə Yusif bəy yazmışlar. Əmirlər onu o həndəvərdə saxlayıb ordugahı arabalarla əhatəyə aldılar, kölgəliklər və çadırlar qurdular.

Beyt

“Göy üzü kimi bir bargah idi,
Orada iki yüz ay və günəş bəzədilmişdi”.

İki gün sonra Murad bəyi çağırdılar. Bir dəstə adama qalmaqların (kalmıkların) paltarını geyindirdilər və söylədilər ki, “bunlar adam yeyirlər”. Murad bəy araba hasarının yaxınlığına çatdıqda bir şəxsi həmin camaatın əlinə verdilər. Dərhal onu para-para etdilər və dedilər ki, “onu yeyəcəyik”. Murad bəyin gətirdiyi bir neçə atı hürkütdülər. Araba hasarının içinə daxil olduqda onu Sultan Mahmud mirzənin divanına apardılar. Əvvəlcə əmirlərlə görüşdü. Ondan sonra padşahın bargahına daxil olub, iyirmi səkkiz yerdə diz vuraraq münasib bir yerdə oturdu. Daha sonra adı çəkilən şəxs (Murad bəy) elçilik qaydasını yerinə yetirərək Həsən padşahın istək və diləklərini ərz etdi. Həsən padşah bu beyti yazmışdı:

“Əgər sən istəyirsən ki, məşuq [sevgi] bəndini qoparmasın,
Kələfin ucunu möhkəm tut ki, möhkəm qalsın”.

Sultan Əbu-Səid dedi:

- Gərək Həsən bəy Azərbaycanı bizə versin. Çünki [bura] mənim atamın qəbrinin olduğu yerdir (atamızın gorxanasıdır). Bundan başqa, oğullarımızı Rum və Şam tərəfə göndərəcəyik. O diyarı fəth etdikdən sonra Azərbaycanın əvəzinə ona bir vilayət verəcəyik.

Sonra isə Murad bəyə izin verdi və bibisi oğlu Mirzə Mahmud Xocalaqı Murad bəylə birlikdə elçi kimi göndərdi.

Onlar zəfər nişanlı orduya çatdıqda Murad bəy görüş əsnasında baş verənləri ərz etdi. Həsən padşah buyurdu:

- At hürkütmək, dövləti hürkütməkdir. Adamyeyənlər saxlamaq, bir məzlumu onların əlinə vermək və onu para-para etdirmək elə bir zülmdür ki, hətta kafirlər belə etməzlər. Azərbaycan mülkünün davasını edərək “bura bizim gorxanamızdır” demək isə o mənaya gəlir ki, onun həlak olması bu diyarda baş tutacaqdır.

Murad bəy dedi:

- Sultan Əbu-Səid, Cahanşahın xəzinələrini özünün irsi malı sayır, Azərbaycan diyarını özünün mütləq mülkü bilir və bu sözlərə görə səndən əl çəkməyəcəkdir.

Həsən padşah ali məclis tərtib etdi. Qoşunun hamısı və ordu başçıları başlarına dəbilqə qoydular, cövşən və zireh geydilər, səflər bağladılar. [Həsən padşah] Yadigar Məhəmməd ibn Sultan Məhəmməd ibn

---

[1205] “Mətləüs-səədeyn”ə görə, bu görüş Sultaniyyədə deyil, Miyanədə baş tutmuşdu *(Nəvai, şərhlər, s.694)*.

[1206] Müzəffəriyyə xanəgahı nəzərdə tutulur *(Nəvai, şərhlər, s.695)*.

[1207] Touliyyət (tövliyyət) – vəqfin idarə olunması. Bu işi icra edən şəxs “mütəvəlli” adlanırdı.

[1208] “Mətləüs-səədeyn”in müəllifi Əbdürrəzzaq Səmərqəndi və “Həbibüs-siyər” əsərinin müəllifi Qiyasəddin Xandəmir nəzərdə tutulur. Lakin Uzun Həsənin tarixçisi Əbu-Bəkr Tehrani “Kitabi-Diyarbəkriyyə” əsərində bu elçinin adını Murad bəy yazdığı üçün bu versiya daha mötəbər hesab olunur *(Nəvai, şərhlər, s.695)*.

Baysunquru taxtda əyləşdirərək özü solda qərar tutdu. Mahmud Xocanı bargaha gətirdilər. O, bir neçə yerdə diz çökdü. Həsən padşah dedi:

- Öz sahibini, yəni Yadigar Məhəmmədi tanı!

O, irəli gəlib şahzadənin əlini öpdü. Ondan sonra Həsən padşah qazı-əsgər olan Qazı Əlaəddin [Əlini] Mahmud Xoca ilə birlikdə sultanın hüzuruna yolladı və [onunla Sultan Əbu-Səidə] belə bir xəbər göndərdi:

- İndiyə kimi bizim tərəfdən [sizə qarşı] məhəbbət yolundan başqa bir rəftar nümayiş etdirilməmişdir və Sahibqiran Əmir Teymur Kürəkanın bizim xanədan haqqında nəvaziş və qayğıkeşliyi müqabilində mümkün olduğu qədər dostluq və birlik göstərmişik. İndi ki yaxşılığın yerini pislik tutacaqdır və hüquqlarımız [sizin tərəfinizdən] qəbul edilməyəcəkdir, o zaman nə görəcəksinizsə, özünüzdən bilin.

Sonra dedi:

- Bizim məsələmiz iki qardaşın məsələsinə oxşayır ki, onlardan biri səhrada iki kuzə su tapmışdı. [Kuzələrdən] birini qardaşına vermiş və birini özünə saxlamışdı. Digər qardaşı yaramazlığının və acgözlüyünün çoxluğundan öz kuzəsini içib qurtarmamış, qardaşının kuzəsinə tamah salmışdı. Qardaşı da ona belə demişdi: “Hər iki kuzəni mən tapdım. Mürüvvət üzündən onu qardaşcasına böldüm. Sən hələ öz kuzəni içib qurtarmamışsan, amma mənim kuzəmə göz dikmişsən”. İraq və Azərbaycan iki kuzədir. Hər ikisini mən tapmışam. İraqı sənə vermişəm. Sən isə hələ oranı zəbt etməmiş, Azərbaycana da tamah salmışsan.

Sonra yenə dedi:

- Biz əvvəl elə bir qılınc kimi idik ki, qəbzəsi sizin əlinizdə idi və onu düşmənə vururdunuz. İndi isə onun qəbzəsini düşmənin əlinə verib özünüzü vurursunuz.

Daha sonra dedi:

- Sizin irsi mülkünüzü Cahanşah padşah ələ keçirmişdi. Əgər Yəzddən bir xərvar yük yükləmək istəsəydiniz, gərək on dəfə Yəzd daruğalarına məruzə edəydiniz və izin alaydınız; əks təqdirdə istəyiniz baş tutmazdı. Sizin elçinizin başına çadırı yıxmışdılar və sizin onunla (Cahanşahla) dava etməyə imkanınız yox idi. Calal sahibinin (Allahın) köməyi ilə sizin dövlətinizin ulduzlarını o bəladan xilas etdik. Gərək siz bunun əvəzində mükafat (cəldu) olaraq, İraq məmləkətlərindən bəzilərini bizə bağışlayaydınız. Lakin siz Azərbaycana da tamah salmışsınız. Bizim sizinlə əhvalatımız eynən Əbu-Müslümlə Əbu-Cəfər Dəvaniqinin hekayəsi kimidir[1209]. O, Abbasilər sülaləsinə havadarlıq edərək Mərvan ailəsini (Əməviləri) devirdi və mülkü Abbasilər üçün təmizlədi. Axırda Mənsur Dəvaniqi ona qəsd etdi. Əgər bizim haqqımız sizin nəzərinizdə zay olmuşsa da, Allahın nəzdində zay olmamışdır.

O, elçiləri bu xəbərlə yola saldı. Həmin zaman qış ordusunun ön dəstəsi göründü və havanın mizacı bəxtsiz aşiqin nəfəsi kimi soyuq oldu. Mövcudluq bağının növcavanı soyuğun qələbəsi ucbatından boy atmaqdan əl çəkib başını qönçə yaxasının içinə çəkdi.

Beyt

“Küləkdən ciyər içində qan dondu,
Qardan ağız içində nəfəs dondu,
Bulud cismə almaz kimi işlədi,
Külək çöhrəyə yeyə kimi təsir etdi”.

Sultan Əbu-Səid qışlaq yurdu üçün əmirlərlə məşvərət etdi. Bəziləri ərz etdilər ki, “zəfər nişanlı orduya Kürdüstandan çoxlu qoyun və taxıl gətirilməsi üçün Miyandüabda[1210] qışlaq etmək lazımdır”. Bəziləri isə dedilər ki, “padşahların qışlağı Qarabağ və Muğandır”. Sultan Əbu-Səid özü ikinci təklifi bəyənib, Miyanədən hərəkət etdi. Şeyx Cəfər Səfəvi və Ömər bəy Cagirlü üfüqlər hökmdarının ehtiyaclarını təmin etməkdən ötrü qabaqcadan Ərdəbilə getdilər. İki-üç gündən sonra Sultan Əbu-Səid Ərdəbilə daxil olub, Şeyx Səfiəddin İshaq xanəgahına gələrək o diyarın böyükləri ilə görüşdü.

Fələk şövkətli ordu Qarabağ ətrafına çatdıqda azuqə azlığı ucbatından Mahmudabada yola düşdü. Yol əsnasında elə bir səhraya çatdılar ki, oranın ot-ələfi zəhərli idi. Nə cahan səyyahlarının gözü orada gecə

---

[1209] Əbu-Müslüm – Əməviləri devirərək Abbasiləri hakimiyyətə yüksəldən xorasanlı üsyan lideridir. Əbu-Cəfər Mənsur Dəvaniqi – Abbasi xanədanının ikinci hökmdarıdır. Əbü-Müslüm onun zamanında öldürülmüşdür.

[1210] Miyandüab – Cənubi Azərbaycanda, Marağadan cənubda yerləşən şəhər. Yerli azərbaycanlılar oranı “Qoşaçay” adlandırırlar.

yuxusunda ikən ayna kimi bir su çeşməsi görmüş, nə də dünyanı dolaşan sürətli şimal küləyinin qədəmi onun ayna misallı suyunun üzərinə toxuna bilmişdi.

Nəzm

“Orada nə quş bir damcı su görmüş,
Nə qulyabanı orada uşaq tapmış.
Havası atəş və kül, torpağı yanmış,
Otunun hamısı zəhər və küləyi səmum.
Sərtliyi gizlindəki ürək dağı kimi,
Uzunluğu cahanın ruzigarı kimi.
Ölümdən savayı əziyyətindən qurtuluş yoxdur,
Orada küləkdən başqa heç nə hərəkət etmir.
Eni enişli-yoxuşlu dünya kimi,
Sanki geniş açılmış bir xalça idi.
Arğacı şoranlıqdan, ipliyi qumdan idi,
Al qırmızı rəngli və divlər kimi görkəmli”.

Həmin otdan yedikləri üçün heyvanlar yoxluq otlağına yollandılar (öldülər). Mahmudabad ətrafı alinəsəb hökmdarın dayanacaq yeri olduqda Əmir Bayəzid Bistamın oğlu Əmir Əli bəy uğursuz aqibətlə üzləşəcək orduya qoşuldu. O əsnada qıtlıq və aclıq bəlası yayıldı. Bir batman arpanın [qiyməti] beş təngəyə çatdı və tapılmaz oldu. Həmin vaxt Əmir Hüseyn Hacı adlı-sanlı bahadırlardan [ibarət] bir dəstə ilə Həsən padşahın fərmanına əsasən qaravulluq etməyə gedib, Sultan Əbu-Səidin adamlarından bir neçə nəfəri qətlə yetirərək orduya qayıtdı. Ondan sonra Həsən padşahın oğlu Uğurlu Məhəmməd döyüşkən bahadırlardan [ibarət] bir dəstə ilə dil tutmaq üçün gedib, dönük çıxmış bir sıra cagirlüləri qətlə yetirdi.

O əsnada qaravullar xəbər gətirdilər ki, Sultan Əbu-Səidin cəbbəxanasını Xorasandan gətirirlər. Həsən padşah, Əmir [Ömər] bəyi[1211] cəbbəxananı ələ keçirməkdən ötrü göndərdi. Əmir [Ömər] bəy yolun üstünə gedib, cəbbəxananı ələ keçirərək [cəbbəxananı] müşayiət edən çoxsaylı bir dəstəni əsir aldı və aləmin pənahı olan dərgaha gətirdi. Mövlana Şəmsəddin Məhəmməd Buxari və Mövlana Sədrəddin Təbib də əsirlərin arasında idilər. Həsən padşah günahlarından keçərək onlara hörmət göstərdi.

Sultan Əbu-Səid Şəki valisi Əbdülqəffarın və Şirvan hakimi Fərrux Yəsarın yanına söz bilən (yaxşı danışan) elçilər göndərib taxıl və azuqə istədi. Onlar orduya çoxlu taxıl göndərdilər. Elə həmin əsnada Hüseyn Xoca Hacılu qaravulluq etməyə gedib, cağatay camaatından bir neçə nəfəri qətlə yetirərək geri döndü. Yenidən Uğurlu Məhəmməd bir dəstə bahadırla dil tutmağa gedib cağatay camaatından bir neçə nəfəri qətlə yetirdi. Xızır bəy Tərxan da gedib bir çoxlarını əsir aldı. Şahəli bəy Pornak da basqın etməyə gedib təqribən əlli nəfəri qətlə yetirdi. Ondan sonra Sultan Həmzə və Yusif bəy gecə basqını edərək bir neçə çadırı yıxdılar. Daha sonra Şah Mənsur, Hüseyn [Üveys və Zünnun] gedib mərdlik göstərdilər. Təqribən üç aya qədər ordu qaravulları sultanın araba hasarının ətrafına basqın etdilər və oraya əl uzatdılar. Cağatay qoşunundan əmirzadələr və adlı-sanlı adamlar bir-birinin ardınca qaçıb Həsən padşaha qoşulurdular və deyirdilər ki, “Sultan Əbu-Səid gəlməyinə peşmandır”.

Sultan Əbu-Səid həmin məkandan köç edərək Mahmudabadın qarşısında mövqe tutmaq istədi. Yolun üstündə keçidə mane olan bir qara su vardı. Keçid üçün oraya üç min xərvar qamış atdılar, qamışların üstünə çoxlu keçələr və palazlar sərdilər və üç gün ərzində qoşun oradan keçdi. Sultan Əbu-Səidin mövqe tutmaq istədiyi yerin bir tərəfi dəniz suyu, o biri tərəfi isə Kür suyu ilə əhatə olunmuşdu. Digər tərəfində isə xəndək qazıdılar və [oranı] arabalarla möhkəmləndirdilər (orada arabalardan istehkam qurdular). Beləliklə, o bölgədə olan çəmənliyi zəbt etdilər.

Həsən padşah, Sultan Xəlili, Şahəli bəy Pornakı, Şeyx Həsən bəy Pornakı, Murad bəy Cahangir oğlunu, Əlixan bəy Cahangir oğlunu və İbrahimşah bəyi üç min nəfərlə gecə basqını etməyə göndərdi. Onlar qaranlıq gecədə ordugaha hücuma keçdilər və xəndəkdə olan hər şeyi qarət etdilər. Ordu sərdarları və dərgah əmirləri icazə istədilər ki, arabadan (düşərgədən) çıxsınlar və həmlə etsinlər. Sultan Əbu-Səid mane olub de-

[1211] Bu şəxsin adı “Əhsənüt-təvarix”in əlyazma nüsxələrində Əmir bəy kimi yazılsa da, Ə.Nəvai “Kitabi-Diyarbəkriyyə”yə əsaslanaraq onu Əmir Ömər bəy şəklində təshih etmişdir *(Nəvai, şərhlər, s.700).*

di ki, “gecə vaxtı yağının üstünə getmək lazım deyildir”. Səhər çağı onların ardınca min süvari arabadan (düşərgədən) çıxıb getdilər və ehtiyatlı bir şəkildə irəlilədilər. Məlum oldu ki, [basqınçılar] iki-üç min süvaridən artıq deyillərmiş. Çox təəssüf etsələr də, faydası olmadı.

O əsnada xəbər çatdırdılar ki, sultanın qoşununun bir fərsəxliyində bir keçid var və orada Şirvan sövdəgərləri (tacirləri) cağatay camaatı ilə alver edirlər. Həsən padşah, Əlixan bəy Cahangiri və Həmzə bəy Bektaşı onları dəf etməyə göndərdi. Sultanın ordusu yaxınlıqda olduğu üçün çoxsaylı dəstə onlara (keçidi mühafizə edən cağataylara) köməyə gəlib, onlara (keçidə hücum edən Ağqoyunlu qoşununa) köməyə çatmaqda olan Xoruz bəyi əsir alaraq ali taxtın ətəyinə gətirdilər. Sultan bahadırlardan [ibarət] daha bir dəstəni onların üstünə göndərdi. Onlar türkman qoşununu məğlub edib, bir neçə nəfəri tutaraq dərgaha gətirdilər. Bu zaman cağatay ordusunun atları və dəvələri son dərəcə arıqlamışdılar.

Şeir

“Yol getməkdən minik heyvanlarının dırnağı düşdü,
Zəiflikdən bədənlərindən yal və quyruğu tökdülər.
Hansı dəvəni qatara bağladılarsa,
Özü hörümçəyə, yüyəni tora döndü”.

Ona görə də xəndəkdən kənara çıxa bilmirdilər. Sağlam atlara malik türkmanlar daim ordunun ətrafına basqın edir və gördükləri hər kəsi o biri dünyaya göndərirdilər. Sultan Əbu-Səidin istəyi bu idi ki, baharda atlarını kökəldib qüvvətli bir şəkildə mərdimazar düşməninin üzərinə getsin. Bu əsnada Şirvan padşahı Fərrux Yəsar rəcəb [ayının] 4-də (18.01.1469) müxaliflik etməyə başlayaraq gəmiləri öz tərəfinə çəkdi və cağatay ordusundan çoxsaylı bir dəstəni lüt-üryan edib, Əbdülxaliq adlı birini layiqli töhfələr və hədiyyələrlə Həsən padşahın hüzuruna yolladı. O həzrət də Fərrux Yəsarın [Sultan Əbu-Səidə qarşı] müxaliflik izhar etməsi səbəbindən Əbdülxaliqə çoxlu hörmət göstərib geri göndərdi.

Şirvan padşahının müxalifliyi ucbatından Sultan Əbu-Səid geri dönmək üçün təbil vurdurub Ərdəbil tərəfə yola düşdü. Geri çəkilmək əsnasında elə bir yerə çatdı ki, orada çoxlu gil və palçıq vardı. Yarım fərsəxdən artıq [əraziyə] kilim, palaz və keçə sərdilər və atları çox çətinliklə [oradan] keçirdilər. Onların təqribən dörd min at və qatırı tələf oldu.

Babiyan mövqeyi[1212] Sultan Əbu-Səidin dayanacaq yeri olduqda ordunun ətrafında xəndək qazıdılar. O əsnada Əmir Bayəzid Bistamın oğulları və Xoca Bürhanəddin itaəti vacib fərmana əsasən, üç min dəvə və iki yüz tümən qızıl götürüb Qızılağaca yönəldilər ki, taxıl və qoyun alsınlar.

Həsən padşah, Sultan Əbu-Səidin geri çəkilməsindən xəbər tutdu. O, Əmir Ömər bəy Mosullunu, Bayandur bəyi, Məhəmməd bəyi, Başarət bəyi, Əmir Aslan Zülqədəri, Mənsur Əfşarı, Murad bəyi, Yusif bəyi, Əbu-Səid İnaqı və Musa bəy Ərəbi min nəfər yaxşı silahlanmış adamla göndərdi ki, onlara basqın etsinlər.

O tərəfdən Əmir Seyid Murad qaravulluq etmək üçün çıxıb Həsən padşahın əmirləri ilə rastlaşdı. Əmir Ömər bəy dedi:

- Sultan Əbu-Səid yüz illik düşmənlərini dost etdi və yüz illik dostlarını düşmən etdi. İndi sülh bağlamamış hara gedir? O, özünün böyük əmirlərini göndərsin ki, biz də kübar əmirlərimizi göndərək və sülh bağlansın.

Ertəsi gün Əmir Məzid Ərğun, Pəhləvan Hüseyn Divanə, Məhəmmədyar Təvaçı, Şeyx Bəhlul, Şir Hacı və Qaraqoyunlu əmirlərindən Əlişəkərin övladları Sultan Cüneyd və Hüseynəli, həmçinin Əli bəy Ağacəri xəndəkdən çıxdılar və həmin yerdə Həsən padşahın əmirlərinə çatdılar. Əmir Məzid gördü ki, onlar çox azdırlar. O, onlara həmlə etdi və onların dəstəsini darmadağın etdi. Hərçənd Əmir Sultan Ərğun “bunların pusqusu[1213] var; gözləmək lazımdır” desə də, qəbul etmədi, onları qovub, bir neçə nəfəri əsir alaraq sultana göndərdi və qoşun sərdarı olan Əmir Ömər bəyi atdan saldı.

O vaxt Həsən padşah dörd yüz süvari ilə dayanmışdı. İshaq ağa ilə Mövlana Şeyx Əhməd düşərgə yeri seçməyə (yurd tutmağa) getmişdilər. Xəbər gəldi ki, cağatay qoşunu Əmir Ömər bəyi məğlubiyyətə uğradıb və buraya yetişməkdədirlər. Həsən padşah taqətsiz olub bir dəstəni mənqəlay təyin etdi və özü atını yəhərləyib yola düşdü.

---

[1212] Babiyan – Ərdəbil vilayətinin Şərqi Meşkin dehistanında bir kənddir *(Nəvai, şərhlər, s.703).*
[1213] Mətndə pusqu sözü türkcə “busu” (pusu) şəklində yazılmışdır *(Tehran çapı, s.704).*

Cağatay ordusu Həsən padşahın gəlib çatdığını müəyyən etdiyi zaman talançılıqla məşğul idi. Onların müqavimət göstərməsi müyəssər olmadı. Naçar qalıb fərar etdilər. Onlardan təqribən beş yüz nəfər, hamısı da əmir və əmirzadə olmaqla qətlə yetirildilər. Əmir Seyid Məzidi Şeyxəli Möhürdarın oğlu əsir aldı. Pəhləvan Hüseyn Divanəni Əli Ərəb tutdu. Digər əmirlər isə fərar edib özlərini ordugaha çatdırdılar. Əlişəkərin oğlu xəndəyin kənarına gələrək, Həsənəlinin oğlu Sultanəlini götürüb fərar etdi. Çaharşənbə günü, Dolça bürcündə ayın tamamilə qaranlığa büründüyü bir gecədə bu məğlubiyyət baş verdi[1214].

Sultan bu məğlubiyyətdən qorxuya düşdü və özünün xilas və nicat yolunu sülh bağlamaqda gördü. O, Seyid Qiyasəddini sülh bağlamaq və Əmir Seyid Məzidi xilas etmək üçün yolladı və [onunla] belə bir xəbər göndərdi: “O həzrətin (Həsən padşahın) sülh şərtləri nədirsə, biz onları qəbul edirik”. Seyid Qiyasəddini göndərdikdən sonra isə o, öz anasını da Seyid Əbdülhəy və Seyid İbrahim Qumi ilə birlikdə göndərdi.

Onlar zəfər nişanlı orduya çatıb sultanın ismarışını ərz etdikdə Həsən padşah dedi:

- Əgər Sultan Əbu-Səid mirzə törətdiyi mürüvvətsizliklərin müqabilində özü təşrif gətirsəydi, onun hər nə istəyi olsaydı, yerinə yetirilərdi.

[Əbu-Səidin] anası buyurdu:

- Onun gəlməməsi üzrlüdür. Çünki çox xəcalət çəkir.

Aləm padşahı buyurdu:

- Əgər Şah Mahmud mirzəni də göndərsəydi, xahişi qəbul olunardı.

Həmin vaxt Həsən padşah tərəfindən elçiliyə göndərilmiş ərdəbilli seyid (Seyyidi-Ərdəbili) gələrək belə ərz etdi:

- Sultan Əbu-Səidin işi bitib. Onunla sülh bağlamağa ehtitac yoxdur. Tezliklə o, viran olacaqdır.

Ona görə də Həsən padşah, Sultan Əbu-Səidin anasını geri göndərdi.

Onlar bəlaya düçar olmuş ordugaha çatdıqda Sultan Əbu-Səidi vahimə və qorxu bürüdü. O əsnada türkman ordusu ordugaha yetişdi və Xorasan əmirləri onlara qoşuldular. Sultan Əbu-Səid əmirlərin vəfasızlığını gördükdə buyurdu ki, nağara vursunlar və övladlarının intizarı ilə bir saat gözlədi. Sultan Məhəmməd və Şahrux mirzə orduya qoşulduqdan sonra məlum oldu ki, Şah Mahmud mirzə bir dəstə əmirlə Sultaniyyə tərəfə fərar etmişdir. Sultan Əbu-Səid mirzə qaçış atına minib fərar etdi. Sultan Xəlil, Zeynal mirzə, Şahəli Bayrami və adlı-sanlı adamlardan bir sıra digərləri müzəffər padşahın (Həsən padşahın) əmri ilə təqib etməyə başlayıb onlara yetişdilər və əsir alaraq gecənin ortasında hökmdar ordusuna gətirdilər. Bütün o qədər qoşununun, dəstələrinin, bacarıqlı adamlarının və saysız arabalarının ona bir faydası olmadı və “müddət bitdiyi zaman sayın bir faydası olmaz” [kəlamının] məzmunu onun halına uyğun gəldi.

Sultan hökmdarın məclisinə yaxınlaşdıqda, Həsən padşah [onu] qarşılamaq üçün çadırdan çıxıb sultanla qucaqlaşdı. Çadıra daxil olduqda ona oturmaq üçün layiqli yer göstərmədi və Əmir Şahəlini ondan qabaqda əyləşdirdi. Sultan söylədi:

- Mənim yerim bura deyildir.

Həsən padşah cavabında buyurdu:

- Əgər özün gəlsəydin, yerin yuxarı başda olardı. Bir halda ki səni gətiriblər, sənin yerin elə oradır.

Sultan buyurdu:

- Bizimlə sizin xanədanınız arasında yüz illik dostluq var. Üç aylıq ədavətə görə qədim dostluğun hüququnu kiçik bir ədavətə qurban vermək lazım deyil.

Həsən padşah buyurdu:

- Dostluq Şahrux padşahın xanədanı ilə bizim xanədanımız arasında olmuşdur. Bizim sizinlə heç bir dostluq əhd-peymanımız olmamışdır. İndi də Şahrux padşahın xanədanından Yadigar Məhəmməd mirzə vardır və o, bizim yanımızdadır. Onun böyük əcdadının hüququ zay olmamışdır. Biz onu qoruyacağıq, himayə edəcəyik və hörmət göstərəcəyik.

Ondan sonra Həsən padşah səhrada olan və iki kuzə su tapan iki qardaşın məsəlini ortaya gətirdi və Sultan Mahmudun yolunun üstünə gəlib onun əsgərlərindən gileylənən şikayətçi qadının hekayəsini söylədi. [Həmin hekayəyə görə] sultan [qadına] buyurmuşdu ki, “indi Ruma gedirəm; oraya gedib qayıtdıqdan sonra

[1214] “Mətləüs-səadeyn”də bu hadisə 14 rəcəb (28.01.1469) tarixinə aid edilmişdir *(Nəvai, şərhlər, s.705).*

sənin işini araşdıraram". Şikayətçi isə cavabında demişdi ki, "bütün bu qədər məmləkətləri öz əlində saxladığın zaman nə etdin ki, Rumu tutduğun zaman nə edəcəksən?!" [Sonra Həsən padşah dedi]:

- Sənin məsələn elə həmin hekayədir. Cahanşahın zamanında onun möhürü olmadan Yəzddən bir xərvar yük apara bilmirdiniz. Biz bütün bu məmləkətləri sənin üçün azad etdik. Amma sən öz qılıncımızın zərbi ilə tutduğumuz Azərbaycanı da bizə vermədin və dedin ki, Rumu və Şamı tutduğum zaman sənə bir vilayət verərəm. İndi tuta bilirsənsə, get Rumu və Şamı da tut!

Ondan sonra sultan buyurdu:

- Əgər mənə yaxşılıq etsən, [bu yaxşılığın] zay olmayacaq. Mənim oğullarım bütün Mavəraünnəhrdə və Xorasanda padşahdırlar. Onların çoxlu məmləkətləri və saysız qoşunları vardır.

Həsən padşah buyurdu:

- Mənim səndən nə qorxum vardı ki, onlardan nə qorxum olsun?!

Söhbət uzandıqda Həsən padşah işarə etdi ki, onu bayıra çıxarsınlar və bir mənzildə yerləşdirsinlər. Bu minvalla onu bir neçə gün mühafizə altında saxladılar. Sultan Əbu-Səid mirzə bəxtiyar xaqan həzrətlərinin (Şahruxun) hərəmi olan Gövhərşad bəyimi qətlə yetirdiyi üçün Həsən padşah, Yadigar Məhəmməd mirzəyə işarə etdi ki, "ondan qisasını al!". Kutvallar onu ata mindirib Yadigar Məhəmmədin evinin qapısına apardılar. Yadigar Məhəmmədin nökərləri onu qətlə yetirdilər. "Biz Allaha məxsusuq və Onun yanına qayıdacağıq"[1215]. Əslində Həsən padşah isəyirdi ki, ona heç bir zərər yetirməsin. Amma axırda Şirvan qazısının təhriki ilə onun qətlinə fərman verdi. Səbəbi budur ki, qazı onunla söhbət etdiyi zaman Sultan Əbu-Səid ona demişdi ki, "şirvanşahın müxaliflik etməsi və bizə ərzaq verməməsi ucbatından Həsən bəy bizə qalib gəldi; yoxsa belə bir hadisə baş verə bilməzdi".

Amma sultanın fərar etməsindən sonra türkman qoşunları soyğuna və qarətə başladılar. Çadır, alaçıq, saray pərdəsi və bargah yerində ikən Həsən padşah [oraya] yetişdi və onun ailəsini (hərfən: evini) qorumaq və adamlarını mühafizə etmək üçün etibarlı şəxslərini göndərdi. Xacəsaraylara buyurdu ki, əvvəlki qaydada öz öhdələrinə düşən işləri yerinə yetirsinlər və adamlar təyin etdi ki, onların halından xəbərdar olsunlar. Bir neçə gün həmin yurdda qaldı. Məğlub edilmiş qoşunun və qəhr olunmuş ordunun ac-yalavaclarına yemək verməyi əmr etdi. Sultan Ənbu-Səidin əmirlərindən hər birinə izin verib onları at və azuqə ilə yola saldı. Fərman verdi ki, qaçanlara hücum etməsinlər. Sultan Əbu-Səid mirzənin anasına hüsn-rəğbət göstərib Sultan Əbu-Səidin cəsədini öz ata-babasının gorxanasında dəfn etməkdən ötrü ona geri dönmək üçün icazə verdi. Onlar Qızılağaca çatdıqda talış camaatı onları qarət etdi. Belə ki, [Əbu-Səidin] cəsədini də çölə tulladılar. Bu xəbər Həsən padşaha çatdıqda Əmir Əbdülkərimi göndərdi ki, sultanın cəsədini Xorasana çatdırsın. [Həsən padşah] Əmir Seyid Məzidə ehtiram göstərdi.

Sultan Əbu-Səidin qətlindən sonra Həsən padşah şəhərləri mühafizə etməkdən ötrü əmirlər təyin etdi. O cümlədən Yaquba tac və xələt verib İsfahana yolladı. Cahanşahın yaxın adamlarından olan Əmir [Zəhirəddin] İbrahimşahı Yəzd hakimi təyin etdi. Həsən Çələbini Qəzvinə, Əmir Zeynalabidin Taromini Taroma, Yarəlini Sultaniyyəyə, Dara bəyi Reyə, Məhəmmədi mirzənin mülazimlərindən olan Cahangir bəyi Savəyə, yenə də Məhəmmədinin yaxınlarından olan Səadətyar bəyi Kaşana, Hacı Əli Qapıçını Ərdistana, soyurğalları Həmədan olan Şah Məhəmməd bəy [ibn] Pir Hacı bəy Gavərudini və Əmirzadə Cahangir [ibn] Şah Hacı bəy Gavərudini Həmədana [təyin etdi]. Bu əmirlər dəstəsi Xalxaldan[1216] və Taromdan Qəzvinə yola düşdülər.

**Ölümlər**

Sultan Əbu-Səid ibn Mirzə Sultan Məhəmməd ibn Mirzə Miranşah ibn Sahibqiran Əmir Teymur Kürəkan. O həzrət ədalətli və səxavətli bir padşah idi. Onun həlak olması ilə cağatay sultanları tamamilə zəiflədilər. Səltənətinin müddəti on səkkiz il olmuşdur. Məmləkəti tamam Mavəraünnəhr, Toxarıstan, Qəzneyn, Kabil və Xorasan idi. Oğulları bunlardır: Mirzə Sultan Mahmud, Mirzə Sultan Əhməd, Mirzə Uluğ bəy, Mir-

---

1215 *Qurani-Kərim, "Bəqərə" surəsi, 152-ci ayə.*
1216 Xalxal – Cənubi Azərbaycanda, Ərdəbildən cənubda yerləşən şəhər.

zə Ömərşeyx, Mirzə Əbu-Bəkr, Mirzə Sultan Murad, Mirzə Sultan Xəlil, Mirzə Sultan Vələd və Mirzə Sultan Ömər[1217].

Şairlərdən biri həmin hadisə haqqında demişdir:

Nəzm

“Qəzavü-qədər Sultan Əbu-Səidin qoşununu məğlub etdi,
Bunu kimsədən bilmə, çünki o, ulduzun və ayın əsiri oldu.
Şirvana ordu apardı və su kənarında qaldı,
Elə bir mənzildə ki, ora nə dayanacaq yeridir, nə də yoldur.
Rəcəb ayında on altı gün keçmişdi (30.01.1469),
Tale yazdı ki, onun əli mülkdən üzüldü.
Təəccüblü bir haldır ki, onun qoşununu,
Uzun Həsən vurdu və tarixi “şirvanşah” oldu”.

Və Mövlana Cəlaləddin Dəvvani də demişdir:

“Sultan Əbu-Səid ki, xosrovluq şan-şövkətində,
Qoca asimanın gözü onun kimi bir cavan görməmişdi.
Həqiqətən, onun ölümü kimi bir ölüm olmamışdı,
[Həmin] ilin tarixi “Sultan Əbu-Səidin qətli” oldu”[1218].

Həmçinin bu il Əbülxeyr xan ibn Dövlətşeyx-oğlan ibn İləni-oğlan[1219] ibn Fulad-oğlan ibn Aybə Xoca ibn Toqtay ibn Bulğan ibn Şeyban ibn Cuci xan ibn Çingiz xan iflic xəstəliyindən vəfat etdi. Oğlu Şeyx Heydər xan onun yerinə keçdi. Məmləkəti Dəşti-Qıpçaq idi. Oğulları bunlardır: Budaq sultan, Sevincük sultan, Kucum xan, Şah Məhəmməd-oğlan.

Həmçinin bu il Cahanşah padşahın oğlu Mirzə Əbülqasım Miyanə ətrafında Həsənəlinin əmirlərinin əli və Həsənəlinin fərmanı ilə qətlə yetirildi. O, son dərəcə zalım və pozğun idi. Kirmanda car çəkdirmişdi ki, qadınlar çovqan oyununa tamaşa etməyə gəlsinlər. Onlar toplaşandan sonra şəhvətin sürətli atını cövlana gətirib murad topunu gözəllərdən almışdı. Nəql olunur ki, bir gün bir kəndə çatmış və şəriət hökmü olmadan bir qızın bakirəliyini pozmuşdu. Növbəti il yolu yenə həmin kəndə düşmüşdü. Bəzi arvadlar həmin mövzunu yada salıb, ələ salmaq üçün həmin qıza demişdilər ki, “kürəkən gəldi”. Mirzə Əbülqasım o kəndə gəldikdə həmin yaramaz qızı eyni işi görməkdən ötrü çağırdı. O qız qadınların onu ələ saldıqlarından Mirzə Əbülqasıma şikayət etdi. Mirzə Əbülqasımın qəzəb atəşi alovlandı və car çəkdirdi ki, üç gecə-gündüz ərzində qoca və cavan qadınlar və kişilər hazır olsunlar. Onlar toplandıqları vaxt əsgərlər qadınları ərlərinin və kişiləri arvadlarının gözü qarşısında zorlayıb alçaldaraq, üzüqara və rüsvay etdilər.

Cahanşah padşah qətlə yetirildiyi zaman Əbülqasım mirzə Kirmanda idi. O, xəstəlik üzündən kəcavədə oturub İraqa və Azərbaycana yollandı. Yəzddən çoxlu qızıl toplayıb İsfahana yönəldi. Şəhərlilər müxaliflik etməyə başladılar. Əbülqasım mirzə Nayin və Quhpayə[1220] yolundan keçərək, dağıntılar törədə-törədə on gündən sonra aləmi yandıran ordu ilə at minib savaşdı. Təqribən üç yüz süvari döyüşmək və vuruşmaq əzmi ilə darvaza üzərinə gəldilər. Rəis Bərəkə yüz əlli oxçu süvari ilə müxaliflərin üstünə getdi və onları pərən-pərən saldı. Xoca Şəmsəddin Məhəmməd və digər böyüklər də mərdliklə vuruşdular. Mirzə Əbülqasımın mülazimlərindən təqribən iki yüz nəfər gedər-gəlməzə göndərildi. Ona görə də Mirzə Əbülqasım İsfahan ətrafından köçüb Cürbadəqana yollandı. O, Xərvə (Xərvərə) ətrafında Əmir Seyid Məzid Ərğuna məğlub olub, Miyanə ətrafında Həsənəlinin əmirlərinin əlinə düşdü. Onlar Həsənəlinin fərmanı ilə onu qətlə yetirdilər.

---

[1217] Ə.Nəvai *(Şərhlər, s.711-712)* Sultan Əbu-Səidin oğullarını bu qaydada sadalamaqdadır: 1) Nizaməddin Sultan Əhməd mirzə; 2) Qiyasəddin Mahmud mirzə; 3) Nurəddin Sultan Məhəmməd mirzə; 4) Müinəddin Şahrux mirzə; 5) Müğisəddin Uluğ bəy; 6) Şihabəddin Sultan Ömərşeyx mirzə; 7) Zeynəddin Sultan Əbu-Bəkr; 8) Nasirəddin Sultan Murad; 9) Müzəffərəddin Sultan Xəlil mirzə; 10) Cəlaləddin Sultan Vələd mirzə; 11) Mirzə Sultan Ömər.

[1218] “Məqtəli-Sultan Əbu-Səid” = 873 h.

[1219] Bəzi məlumatlara görə: “İlti-oğlan” *(Seddon, şərhlər, s.299).*

[1220] Nain – İranın İsfahan vilayətində şəhər. İsfahandan 140 km. şərqdə və Yəzddən 170 km. şimal-qərbdə yerləşir. Yəzd – İsfahan yolu üzərindədir. Quhpayə – Nainlə İsfahan arasındadır.

## 874-CÜ İLİN (11.07.1469 – 29.06.1470) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### Sultan Hüseyn mirzənin Xorasan diyarını ələ keçirməsi

Sultan Əbu-Səid Azərbaycan vilayətində qiyamət əlamətli türkman qoşunu ilə vuruşma və qarşıdurma ucbatından gedər-gəlməzə yollandığı zaman Sultan Hüseyn mirzə Manqışlaqdan Xorasan tərəfə sürətli yürüş etdi. O, Nisa və Bavərd ətrafına çatdıqda, darüssəltənə Heratda hökumət və daruğalıq [işləri] ilə məşğul olan Əmir Tacəddin Həsən Məliki və Əmir Binəzir bürcləri və qala divarlarını möhkəmləndirməyə başlayıb hökmdarın məiyyətinin gəlişi xəbərini Səmərqəndə göndərdilər. Mirzə Sultan Əhməd həddən artıq qoşun toplayaraq döyüş və vuruş əzmi ilə Ceyhundan keçdi. Bu əsnada Sultan Əbu-Səidin şəhid olması haqqında xəbər yayıldı. Sultan Hüseyn mirzə köhlən atının yüyənini darüssəltənə Herata sarı çevirdi. Taleyin qeybdən gələn səsi hal dili ilə nida etdi:

Beyt

“Cəmşid taxtı və Fəridun tacı,
Sənin nazik ayağının arzusundadır”.

[Bu nida] o həzrətin qulağına çatdı. Mirzə Sultan Əhməd bu xəbərlərin doğruluğunu müəyyənləşdirdikdən sonra dönüş bayrağını darüssəltənə Səmərqəndə doğru qaldırdı. Mirzə Sultan Mahmud pəncşənbə günü, 873-cü ilin ramazan [ayının] 2-də (16.03.1469) Herata çatıb üç-dörd gün həmin şəhərdə qaldı və gördü ki, insanlar çox-çox (dəstə-dəstə) Sultan Hüseyn mirzənin dərgahına üz tuturlar. Belə olduqda, o, Xorasan səltənətindən könlünü çəkib Əmir Qənbər Əli ilə ittifaqda Məvəraünnəhr tərəfə tələsdi. O zaman Əmir Şeyx Əbu-Səid Candərmiyan, Sultan Hüseyn mirzə tərəfindən Herata daruğalıq etməyə gəlib öz ədalətinin nurları ilə hamının hal yanaqlarını parlatdı. Çaharşənbə günü, sözügedən ayın [8-də] (22.03.1469) böyüklər və əyanəşrəflər uğurlu və qalib hökmdarı qarşılamağa tələsərək Pavlika dağının şimalında onun feyz bəxş edən barmaqlarının qarşısında əyilməklə iftixar və baş ucalığı qazandılar. O həzrət bütün elm və fəzilət əhlinə hörmət göstərib Təxti-Hacıbəy [adlı yerdə] dayandı. Cümə günü Herat şəhərində xütbə Sultan Hüseyn mirzənin adı və ləqəbi ilə zinətləndi.

Sultan islam minbərlərində itaəti vacib olan on iki imamın adının xütbədə çəkilməsini və xəlifələrin adlarının tamamilə ortadan qaldırılmasını istədi. Qaindən olan, moizə oxuyan və şiəlikdə ifrata varan Seyid Əli Vahidüleyn, Qurban bayramı günü namazgahda islam minbəri üzərinə çıxıb şiə məzhəbini dəstəkləyən və əhli-sünnəti (sünniləri) tənqid edən sözlər deməyə başladı. Əhli-sünnət və cəmaətin (sünniliyin) təəssübkeşləri hay-küy salıb, namazgahdan qalxdılar, fəryad və fəğan edərək padşahın yanına getdilər. Həmin zaman səadət nişanlı məiyyət Xiyaban küçəsi yolundan bayram məkanına (eydgah) doğru gedirdi. Yol əsnasında [Sultan Hüseyn mirzə] vaiz seyidin ifrata varması xəbərini eşidib qəzəbləndi. O, vaizi tam bir rəzalətlə minbərdən endirmələri üçün [oraya] bir dəstə göndərdi.

Bu il Sultan Hüseyn mirzə, Şeyx Zahid Taromini bir dəstə bahadırla Astarabadda hakimlik etməyə göndərdi. O zaman Sultan Əbu-Səidin Mirzə Mənuçöhr adlı bir qardaşı vardı. O, Qarabağdan Mazandarana gəlmiş, Sari və Rüstəmdarı ələ keçirmişdi. Şeyx Zahid Taromi qəflətən ona həmlə edib onun mövcudluq vilayətini həyat valisindən məhrum etdi.

O əsnada Mirzə Kiçik ibn Mirzə Sultan Əhməd ibn Mirzə Seydi Əhməd ibn Mirzə Miranşah kimi məşhur olan Mirzə Sultan Məhəmməd[1221] pis bir halda Qarabağdan aləmin pənahı olan dərgaha gəlib çatdı və tam hörmətlə qarşılandı. Ona qoşun, məiyyət, təbil və bayraq (ələm) verildi. Daim Azərbaycandan və İraqdan üfüqlərin başbilənləri dərgaha gəlməkdə və öz vəziyyətlərinə uyğun ehtiram görməkdə idilər. O cümlədən Sultan Əbu-Səidin böyük əmiri (miri-müəzzəm) Seyid Murad ali divanda əmirlik şərəfi qazandı.

### Yadigar Məhəmməd mirzənin Xorasana qoşun çəkməsi və onun Sultan Hüseynlə müharibə etməsi haqqında söhbət

Bu ilin əvvəllərində Həsən padşah, Yadigar Məhəmməd mirzəni himayə edərək onu çoxlu ordu və Şeyx Əbülfəzl Əleykə, Əbülhəsən Tərxan, Əmir Şeyx Hacı, Əmir Məhəmməd Bəhlul, Pir Məhəmməd Pir-

[1221] Bu şəxs Sultan Hüseyn mirzənin bacısı oğlu idi *(Nəvai, şərhlər, s.718).*

zad, Şeyx Məhəmməd Tuğayi, Əli Cəlair, Pir Osman Hindukə, Sultan Əhməd Çaharşənbə və Hüseyn Xarəzmi kimi adlı-sanlı əmirlərlə Xorasanı fəth etməyə göndərdi. Onlar Mazandarana çatdıqda, Sultan Hüseyn mirzə tərəfindən o diyarın valisi olan Şeyx Zahid Taromi müqavimət göstərmətə tab gətirməyib fərar yolunu tutdu.

Bu xəbər Sultan Hüseyn mirzəyə çatdıqda Əmir Mübarizəddin Vəli bəyi və Əmir Nasirəddin Əbdülxaliqi sürətli yürüş etməkdən ötrü səf yaran ordu ilə birlikdə düşməni dəf etməyə göndərdi. Onlar Nişapur yolundan Səməlqana getdilər. Bir neçə gün orada qaldılar. Əmirlərin getməsindən sonra Sultan Hüseyn mirzə, Mirzə Kiçiyi də onların ardından yolladı. Şahzadə Səməlqanda onlara qoşuldu. Onlar birgə halda həmin zaman Astarabad keçidindən çıxmış Mirzə Yadigar Məhəmmədə sarı üz qoydular. Onlar Şurab mövqeyinə çatdıqda, Sultan Hüseyn mirzədən gəlmiş hökm və fərmana (nişan) əsasən, yüyənlərini döyüş meydanından çəkib, möhkəm bir yer olan Xoruzyaylağı dağına sığındılar. Mirzə Yadigar Məhəmməd sözügedən dağın ətəyinə tələsib o dağın mükəmməl dərəcədə mətanətli olduğunu gördü. Sonra oradan hərəkət yüyənini İsfərayin tərəfə çevirdi. O tərəfdən Sultan Hüseyn mirzə rəbiüləvvəl [ayının] 4-də (11.09.1469) ən gözəl bir saatda yaraşıqlı Herat şəhərində mübarək ayağını səadətin mənsub olduğu üzəngisinə qoyub fəth ayəli bayrağını dövlət düşmənlərinə tərəf qaldırdı. Mərhələləri adladıqdan sonra İmam Rzanın – ona salam olsun – məqbərəsinin yerləşdiyi müqəddəs Məşhədi öz şərəfli qədəminin uğuru ilə Gülüstani-İrəmə həsəd bəxş edən yerə çevirdi. Sultan Hüseyn mirzə həmin yerdən də köç etmək istədiyi üçün buyurdu ki, münasib saatı seçmək üçün münəccimi hazır etsinlər. Əmir Əlişir hökmdara söylədi:

- Münəccim dəvət etməklə zamanın uğurlu və ya uğursuz olduğunu müəyyənləşdirməyin faydası yoxdur. Çünki əgər münasib saat olarsa və ya olmazsa, laqeydlik göstərməkdən və burada qalmaqdan imtina etmək lazımdır. İndi sürətlə hərəkətə keçmək vacibdir.

Şeir

“Sabiqən Tanrının lütfünə malik olan bir kimsəyə,
Ulduzlar və fələklər bir şey edə bilməz.
Kövsər sərçeşməsindən su içən Tuba ağacının[1222],
Bahar buludundan bəslənməyə ehtiyacı yoxdur”.

Həzrət Sultan Hüseyn mirzə, Əmir Əlişirin fikrini bəyənib düşmənlərin üstünə getdi. Bir qədər hərəkət etdikdən sonra aydın oldu ki, mətləbə yetməkdən ötrü at minmək üçün son dərəcə uyğun bir saat imiş. Bu səbəbdən zəmanə hal dili ilə yaxşı xasiyyətli əmirə xitab edib bu mövzunu tərənnüm etdi:

Şeir

“Sənin fikrinin günəşi əgər kölgə salsa səmaya,
Ay utanar, göyün günəşindən işıq aldığı üçün.
Sənin işıqlı fikrinin qarşısında kainatın sirri kəşf oldu,
İlahi nurun batdığı yer, gizlənmə yeri olmaz”.

Xülasə, Yadigar Məhəmməd mirzə Çinarana çatdıqdan sonra Mirzə Kiçik və əmirlər sürətli yürüş edib sığındıqları yerdən hərəkətə gəldilər və hökmdarın məiyyətinə qoşuldular. Zəfər ayəli bayraqlar Çinaran tərəfə hərəkət etdi. Müxaliflərin düşərgəsinin ətrafına və çevrəsinə yetişdikdən sonra [Sultan Hüseyn mirzə] ordunu öndən, arxadan, soldan və sağdan lazımınca tərtib etdi. O tərəfdən Mirzə Yadigar Məhəmməd də qoşun tərtib etməklə məşğul olub savaş və döyüş məqamında dayandı.

Şeir

“Süvarilərin tozanağından hava duman bağladı,
İldırım kimi parladı qılıncın poladı.
On-on əsgər çıxdı hər iki qoşundan,
Yer minik heyvanlarının dırnağından təngə gəldi”.

Yadigar Məhəmməd mirzə hər biri bahadırlıqdan dəm vuran bir dəstə türkmanlarla və qoşununun etibarlı adamları ilə həmlə etdi. Sultan Hüseyn mirzənin ordusunun əksəri sarsıntıya məruz qaldı. O həzrət

---

[1222] Tuba – dini rəvayətlərə görə, cənnətdə gözəl və hündür bir ağacdır.

“Neçə dəfə olub ki, az bir dəstə Allahın izni (iradəsi) ilə çox bir dəstəyə qalib gəlib!”[1223] [ayəsinin] məzmununa etimad edərək müxaliflərin qoşununa həmlə etdi. Müxaliflər meydandan üz döndərib, can qorxusundan qaçmağa üz qoydular. O həzrət kama və murada çatmış halda Çinaran mövqeyində cah-calalla yerbəyer oldu. O, savaşda əsir alınmış Şeyx Bəhlul Kaşini, Şeyx Səid Tuğayini və Məhəmməd Kükəltaşı qətlə yetirdi. Əmir Həsən Şeyx Teymuru Astarabada hakim göndərib, özü nəfis vücudu ilə Herat tərəfə qayıtdı.

Yadigar Məhəmməd mirzə döyüş meydanından çıxdıqdan sonra tamam fəlakətlə özünü Simnana daxil etdi. Sultan Hüseyn mirzə də Həsən padşaha elçi və məktub göndərdi. [Məktubun] məzmunu belə idi: “Bu iki xanədan arasında dostluq və uzlaşma vardı. Əgər Sultan Əbu-Səid mirzə mürüvvətsizlik yolunu tutdusa da, öz cəzasına çatdı. İndi o həzrətdən (Həsən padşahdan) ümidimiz və təvəqqemiz budur ki, şəfqət gözü ilə bu cənaba nəzər salsın və məni digərlərindən əskik saymasın”.

Həsən padşah elçiyə padşahlara layiq nəvazişlər göstərib Qaraqoyunluların cinayətləri və qəbahətləri, onların qədəmlərinin uğursuzluq gətirməsi barədə bir məktub yolladı. Belə buyurdu:

“Qaraqoyunluların qədəmləri uğurlu deyildir. Əmir Qara Yusif Ruma sığındı, Sahibqiran Əmir Teymur Kürəkanı [öz arxasınca] Ruma gətirib o diyarı xaraba qoydu. Oradan Misirə və Şama getdi və Bəxtiyar Sahibqiranı da öz ardınca Şama apardı. Nəticədə, o diyar bütünlüklə xaraba qaldı. Mirzə Əlvənd ibn İsgəndər ibn Qara Yusif, qardaşım Cahangir mirzənin dərgahına pənah gətirdi. Uca Əlvənd dağı kimi möhkəm və dayanıqlı olan yüksək dağ[1224] “didilmiş yun kimi”[1225] yelə getdi (küləklə sovruldu). Elə ki Babur mirzəyə qoşuldu, onu da əslən və nəslən sıradan çıxardı. Həsənəli də Sultan Əbu-Səidə qoşulduqda ona olan oldu.

Bundan başqa, məxfi deyildir ki, bu rəzil tayfanın davamlı adətləri zülm və fəsadın bünövrəsini qoymaqdan, fitnə və inadın sütunlarını möhkəmlətməkdən ibarət olduğu üçün rəzalət və zillət tozundan qaynaqlanan uğursuzluğun bədbəxtliyi onların dövlətinin alnına qonmuşdur. Onlar Ulu Tanrı tərəfindən rədd edilmiş və qovulmuşlar. Çarəsizlikdən hansı tərəfə qədəm qoyurlarsa, təfriqəyə və pərişanlığa səbəb olurlar. Sərsəri külək kimi keçdikləri hər diyarda onların qalmaqalından əhalinin əhvalına xətər yol tapır. Bu məna təcrübə vasitəsilə aləm sakinlərinə aydındır. Bu tayfanın bəxt ulduzunun yüksəlişə üz qoyduğu ilk vaxtlarda onların qədəmi belə (uğursuz) idi. İndi isə hadisələrin fırtınası ilə onların dövlətinin təməlinin yerlə yeksan olduğu və hadisələrin sərsəri küləyi ilə onların tale fidanının yerə yıxıldığı bir vaxtda onlara yardım etməyin faydası olmaz.

Nəzm

“Bir ağac ki, təbiəti etibarilə acıdır,
Əgər onu behişt bağına əksən,
Və əgər onu cənnət çeşməsi ilə sulasan,
Kökünə bal və xalis şan balı töksən,
Axırda yenə onun xilqəti işə başlayar,
Həmin acı meyvəsini yetişdirər”.

Xahişimiz odur ki, onları həbs edin. Yoxsa məxfi deyil ki, o rəzillərin varlığından və yoxluğundan bizim ətəyimizə bir toz qonmayacaqdır.

Şeir

“Cahanın qalmaqal və çaxnaşma ilə dolu olması ondandır,
Aləm əhlinin pərişanlığı ondandır.
Onu cəza qılıncı ilə məhv etmək lazımdır,
Bədbəxtlərə xeyirxahlıq etmək xətadır”.

Cahanşah padşahın qoşununun çoxluğuna, həşəmətinin bolluğuna, arzusunun və amalının böyüklüyünə baxmayaraq, aləm sakinləri onun nə vəziyyətə düşdüyünü gördülər.

Misra

“Məlumdur ki, bu qurtumdan necə bir sərxoşluq yaranır”.

---

[1223] *Qurani-Kərim, “Bəqərə” surəsi, 249-cu ayə.*
[1224] Cahangir mirzə nəzərdə tutulur.
[1225] *Qurani-Kərim, “Qariə” surəsi, 5-ci ayə.*

Külli məqsədimiz dostluq qaydalarını sınaqdan keçirməkdir. Bundan başqa, gizli deyildir ki, o cənabın elçisi Şiraza gəldiyi zamandan bəri heç vəchlə bizim tərəfimizdən Yadigar Məhəmməd mirzəyə nə qoşunla, nə taxılla, nə də pulla yardım göstərilməmişdir. Belə ki, eyni zamanda o, bizim könlümüzün ondan incik düşməsinə səbəb olan bir əməl törətmiş, yəni Simnana daruğa təyin edib göndərdiyimiz Fəzlulla Pirzadı qətlə yetirmişdir. Niyyətimiz budur ki, aramızda sürəkli olaraq dostluq qaydalarının təməlini möhkəmlədək və bu yolda cidd-cəhd göstərək. İndi sözügedən camaat (Yadigar Məhəmməd mirzə tərəfdarları) öz mənfəətləri uğrunda aralıqda fitnə-fəsad salırlar. Əli Cəlair, Məhəmməd Simnani, Seyid Zeynalabidin Sarəvi və Əlişəkər o cənabdan (Sultan Hüseyn mirzədən) bu müxlisə (Həsən padşaha) və bu tərəfdən o cənaba fitnə-fəsad yaradan sözlər və xəbərlər çatdırırlar və köhnə səmimiyyət və dostluğun təməlini dağıtmağa səy göstərirlər. Məqsədimizin xülasəsi odur ki, könlümüzün istəyi Hüseynlə Həsənin[1226] qardaşlıq yoluna hər iki tərəfin əməl etməsindən başqa bir şey deyildir və bunun nəticələri ən gözəl tərzdə ruzigarın çöhrəsində zühur edəcəkdir".

Və qazı-əsgər olan Qazı Əlini elçi kimi Sultan Hüseyn mirzənin yanına göndərdi. Sultan Hüseyn mirzə Əlişəkərin övladlarını [təhvil] vermədi. Ona görə də Həsən padşah, Şahəli bəy Pornakı və Hüseyn bəyi Astarabadı idarə etmək üçün göndərdi. Onların ardınca Yusif bəy, Hüseyn bəy, Şahmənsur [ibn] Şahsüvar Bayrami və İshaq ağanın qardaşı Yaqub kimi bəzi böyük əmirləri ağır bir ordu ilə Yadigar Məhəmməd mirzəyə köməyə göndərdi. Onların da ardınca Sultan Xəlili yolladı. Sultan Xəlil bir dəstə bahadırla Astarabada daxil oldu. Sultan Hüseyn mirzə tərəfindən oranın hakimi olan Əmir Həsən Şeyx Teymur Şəmasan qalasına sığındı. Zeynal mirzə də Kirmandan hərəkət bayrağını Xorasan tərəfə qaldırdı və Darab bəylə Əhməd bəy Pornakı mənqəlay [təyin] etdi. Onlar Sultan Hüseyn mirzə tərəfindən Quhistan valisi olan Şeyx Zahid Taromi ilə vuruşub onu qətlə yetirdilər.

Bu xəbər Sultan Hüseyn mirzəyə çatdıqda o, Nasirəddin Əbdülxaliq, Şeyx Əbu-Səid Candərmiyan və Pirəli Türkman kimi böyük əmirlərini ağır bir ordu ilə Yadigar Məhəmməd mirzəni dəf etməyə göndərdi. Müxaliflərin qoşununun Nişapur və Səbzəvar hüduduna qədər gəldiyini eşitdikdən sonra öz nəfis vücudu ilə əmirlərin ardınca sürətli yürüşə çıxıb Radkan çəmənində (Üləngi-Radkan) onlara qoşuldu və həmin vaxt Yadigar Məhəmməd mirzənin və türkman ordusunun düşərgəsinin yerləşdiyi Səbzəvar şəhərinə üz qoydu. Onlar dünyanı tutan hökmdarın gəlişinin yaxın olduğundan xəbər aldıqda, Qazı bəyi Səbzəvar qalasında qoyub qaçmağa qərar verdilər və hərəkət bayrağını Cacərm tərəfə qaldırdılar.

Şərəfli hökmdarın günəş misallı tuğunun ayparası Səbzəvar diyarının üfüqündən doğduqda, qələbə şüarlı ordu bir həmlə ilə Qazı bəyi dustaq edib əsir aldı. Şəhərlilərə qarşı zülm və əziyyət yolunu tutmuş imansız türkmanlardan yetmiş nəfəri məzlumlara tapşırdılar və onların hamısını həlak torpağı üzərinə tökdülər. Həmin zaman qələbə əlamətli bayraqlar talesiz düşmənlərin arxasınca hərəkətə gəldilər. Pəncdəhnə mövqeyi[1227] yeddi iqlim[1228] padşahının düşərgəsinə çevrildikdə müzəffər ordunun bir dəstəsi səadət dəstgahlı qoşunun qaravulları ilə rastlaşdılar və onların həyat damarını qopardılar. Mirzə Yadigar Məhəmmədin dövlət ərkanından bir çoxlarını, o cümlədən Nemət Xarəzmi, Qasım Dövlətmülk və başqalarını əbədiyyət aləminə yolladılar və ali ordu həmin məkandan hərəkət etdi.

Cacərm bölgəsi sultan mülazimlərinin çadırlarının qurulduğu yerə çevrildikdə, məiyyət dəstələri və qoşun təbəqələri vəfasızlıq yolunu tutub düşmənlərə qoşuldular. Sultan Hüseyn mirzə zamanın tələbinə uyğun olaraq, yüyənini geri çevirib sağlıq və salamatlıq zəmanəti altında müqəddəs Məşhədə yetişdi. Oradan da hərəkət edib Xatun körpüsü[1229] ətrafında hökmdarın yüklərinin (ağruqi-hümayun) olduğu yerə çatdı.

---

[1226] Burada Həzrət Əlinin oğulları olan İmam Həsənlə İmam Hüseynin qardaşlığına işarə olunmuş, iki hökmdar arasındakı münasibətlərin də qardaşyana olmasına dair arzu ifadə edilmişdir. Ağqoyunlu hökmdarının adı Həsən, Teymuri hökmdarının adı Hüseyn idi *(Nəvai, şərhlər, s.723)*.

[1227] Pəncdəhnə (Beşkeçid) – Xorasandan hərəkət edildiyi zaman Damğandan cənubda yerləşən Bəhrabad mahalının qurtaracağındadır.

[1228] Yeddi iqlim – orta əsr müsəlman coğrafiyaşünaslığına görə, dünyanın insanla məskunlaşmış ¼ hissəsi 7 iqlimə bölünürdü (bax: *Əbdürrəşid əl-Bakuvi. Kitab təlxis əl-asar və əcaib əl-məlik əl-qəhhar /Abidələrin xülasəsi və qüdrətli hökmdarların möcüzələri/. Ərəbcədən tərcüməsi, müqəddimə və şərhləri Z.M.Bünyadovundur. Bakı, 1992*).

[1229] Xatun körpüsü (Püli-Xatun) – Məşhəddən təxm. 80 mil şərqdə, Kəşf çayının Hərirud çayına töküldüyü yerdə yerləşir *(Seddon, şərhlər, s.276)*.

Eyni zamanda, divan məsələlərini idarə etmək və sultanın işlərini aparmaq üçün Heratda qalmış Abdulla Əxtəb zülmkarlıq və amansızlıq etməyə başlayıb biçarə rəiyyətin üzərinə ağır yüklər qoymuşdu. Bütün camaat hücum edib onun oturduğu yer olan mərhum xaqanın (Şahruxun) xanəgahına üz qoydular və daş atmağa başladılar. Abdulla can qorxusundan aradan çıxıb bir evə sığındı və o fitnə-fəsad tamamilə sakitləşdi. Bu hadisə barədə xəbər Xatun körpüsü məkanında qanunpərəst hökmdara ərz edildikdə buyurdu ki, darüssəltənə Herat sakinlərinin könlünü almaqdan ötrü inayətnamələr (nəvaziş məktubları) yazsınlar və onları sultan həzrətlərinin yaxın adamı olan Əmir Əlişirlə birgə şəhərə göndərdi. O cənab özü gözəl Herat şəhərinə çatıb, qayğı və mərhəmət qanadlarını zülmə uğrayanların başları üzərində açdı, zülm və bidət sahiblərinin əlini zavallı məzlumların üstündən çəkdi. Sultan Hüseyn mirzə hökmdar yüklərini Xatun körpüsündən Nərətu qalasına tərəf göndərib özü darüssəltənə Herata hərəkət etdi və ən uğurlu bir saatda Nəzərgah bağına cah-calalla daxil oldu.

Səadətli sultan bir neçə gün gözəl Herat şəhərində qaldıqdan sonra onun qulağına çatdı ki, Yadigar Məhəmməd mirzə Xəbuşan hüduduna gedib və o hüdudda mövqe tutub Məşhədə irəliləmək istəyir. Ona görə də müzəffər bayraqlar Nəzərgah bağından müqəddəs Məşhədə yola düşdülər. Bəşərtu çəməni (Üləngi-Bəşərtu) ali məqamlı [hökmdarın] xadimlərinin düşərgəsinə çevrildi. O məkanda da məiyyət dəstələri və ordu təbəqələri fərarilik yolunu tutub Mirzə Yadigar Məhəmmədin ordusuna üz tutdular. O səbəbdən hökmdarın fikrinə gəldi ki, bir neçə gün gözləmək və hərb işini təxirə salmaq daha münasibdir. Sonra Bəşərtudan köç etdi. Kələkuh [dağının] ətəyi yüksək məqamlı padşahın bargahının qurulduğu yer oldu. Ali məiyyət oradan da hərəkətə gəlib Toqquz-ribat yolundan Nərətu qalası tərəfə tələsdi. O qalanın ətrafı fələk iqtidarlı hökmdarın qədəminin uğurundan gözəllik və zinət tapdıqda, sultan belə bir tədbir tökdü ki, qadınlar (hərəmlər) bir müddət qalada qalsınlar və mənzillərin təyini və tərtibi üçün Əhməd Tuğçunun yanına bir qasid göndərdi. Adı çəkilən şəxs cavab verdi ki, "əgər o həzrət mülazimlərindən bir-iki nəfərlə gələrsə, qapını açaram; yoxsa açmayacağam". Üfüqlər hökmdarı dürüstlükdən uzaq olan bu cavabdan nifaq əlaməti sezib, bu işdən əl çəkərək Mürğab çayı kənarına yönəldi və Əmir Müzəffər Barlasın xahişi ilə Meymənə və Faryaba yollandı.

Mirzə Yadigar Məhəmməd, Sultan Hüseyn mirzənin fərar etdiyini eşitdikdə, Mürğab çayı kənarına qədər onun ardınca sürətli yürüş etsə də, onun tozuna belə çata bilmədi. Oradan geri dönüb ayın par-par parladığı bir gündə Kəhdəstan çəmənində dayandı və ertəsi günü ayın bir həftəlik olduğu düşənbə günündə, məhərrəm [ayının] 9-da (08.07.1470) Zağan bağına daxil oldu. O, türkman əmirlərinə ürək açan mənzillərdə və könül oxşayan məkanlarda yer verdi. Hüseyn Xarəzmini Həsən padşahın yanına göndərdi və Xorasan əyalətinin fərmanının ona verilməsini xahiş etdi. Həsən padşah hərçənd bu xahişin qəbulunu bör növ ədəbi tərk etmək saysa da, amma bunun o oğula ağır gəlməməsi üçün belə bir fərman qələmə alınmasını buyurdu: "Bütün Mavəraünnəhr və Xorasan məmləkətləri, onun iqtidarının əlində olan hər yer və bundan sonra İlahi lütfün yardımı ilə ixtiyarı altına alacağı hər yer tamamən o cənaba tapşırılacaq və veriləcəkdir. [Qarşıda duran] vəzifə budur ki, səltənət işlərində, məmləkəti idarə etməkdə və rəiyyətpərvərlikdə gözəl səylər göstərib, şəriətpərvərlikdə "dövlət və din əkiz qardaşdır" məzmununu göz önündə tutsun. Zülm və düşmənlik maddələrini dəf etmək istiqamətində çalışıb, "dövlət zülmlə qalıcı olmaz" kəlamından ibrət alsınlar. Nəzər-diqqətini Allah övliyalarının himmətindən yardım almağa sərf etsin və bütün məsələlərdə arxayın olsun, ağlına narahatçılığın yol tapmasına imkan verməsin. Çünki, həqiqətən, Allah-taalanın izzəti ilə bu barədə qüsur yoxdur və bu məsələ şəkk-şübhə pisliyindən qorunmuş və hifz edilmişdir. Biz təvəqqe və tamah əlimizi o məmləkətlərin ətəyindən çəkmişik. İstəyimiz odur ki, böyük əmirin (Teymurun) zamanından ata-babalarımız arasında mövcud olan qədim dostluğun sütunlarının bünövrəsi gündən-günə möhkəmlənsin. Qadirin (Allahın) təqdiri ilə bizimlə Sultan Əbu-Səid mirzə arasında baş vermiş hadisənin isə səbəbi bu idi ki, o, iradə yüyənini insaf yolundan azdırmış və işlərin cilovunu mötədillik yönündən kənara çıxarmışdı. Bu [hadisənin] mahiyyəti dünyaya və dünya sakinlərinə bəllidir. İnşallah, qədim əhd-peyman qaydalarının bərqərar edilməsi üçün çalışacağıq və elə edəcəyik ki, bir daha dəyişkənlik əli onun ətəyinə yetişməsin. Çünki alçaq dünyanın etibarı yoxdur və heç kəsə vəfa etməmişdir. Cahanşah mirzənin və Sultan Əbu-Səid mirzənin əhvalatı bu məsəli sübut edir".

**Rum diyarında baş vermiş hadisələr haqqında söhbət və Sultan Məhəmməd padşahın Ağrıboz adasını tutması**

Bu il Venedik padşahının[1230] əmirülümərası olan azğın kafir Cetezal[1231], sultanın istirahət etdiyinə və mücahidlər ordusunun sakit durduğuna güvənib səksən ədəd böyük gəmi ilə islam məmləkətlərini xaraba qoymaq üçün yola çıxdı və dəniz sahilində yerləşən Ağrıboz[1232] vilayətinin qarşısında gəmidən çıxıb şəhərləri dağıtmaq və bəndələrə zülm etməklə məşğul oldu. Ona görə də Rum padşahı Sultan Məhəmməd o kafirin və onun saysız qoşunlarının şərini dəf etməkdən ötrü hərəkətə keçdi. O, əmirlərin və dövlət ərkanının məsləhəti ilə hərəkət bayrağını Ağrıboz adası səmtinə qaldırdı. Bu ada yunan adalarının ən genişi olub, filosoflar şəhəri kimi məşhurlaşmış Asine (Afina) ölkəsinin qarşısındadır və bir qalası vardlr.

Sultanın buyruğu ilə Mahmud paşa sahilin yaxınlığında, şəhərin qarşısında lövbər saldı. O əsnada xəbər çatdı ki, Cetezal hər biri dəniz səfərində səba küləyinə çeviklik öyrədən və dənizdə yaxşı üzməyi bacaran təcrübəli kafir döyüşçülərlə və çoxlu top-tüfənglə dolu olan səksən gəmi ilə qala əhlinin köməyinə gəldi. Rumilər top zərbəsi ilə onların bir neçə gəmisini sındırdılar. Onlar (venesiyalılar) dənizin ortasında lövbər saldılar və öz-özlərinə qərar verdilər ki, sultan qoşunu qalaya hücum edərsə, onlar da rumilərin arxasına keçib, onlara mane olmaq üçün bağladıqları zəncirləri açaraq özlərini qalaya daxil etsinlər. Sultan pozğun kafirlərin məkrindən agah olduqda hökm etdi ki, əsgərlər qalaya hücum ləvazimatını hazırlasınlar və qalaya dırmanmaq üçün nərdivanlar düzəltsinlər. Döyüşün üçüncü gün başlanacağı qərara alındı.

Bu əsnada sultanın qoşunundan bir xidmətkar qüsl almaq üçün dənizin kənarına getmişdi. Kafirlər onu tutub Cetezalın və b. kafir sərdarların yanına apardılar və sultanın vəziyyətinin necəliyini, onun qalaya hücum etmək əzmində olduğunu təfsilatı ilə ondan öyrəndilər. Sultan bir adamının əsir düşməsindən xəbərdar olduqda elə həmin gün döyüşə başladı[1233]. Kafirlər və qala əhli döyüşün üçüncü gün başlanacağını hesab etdikləri üçün qalada və gəmilərdə yaraqlarını lazımınca hazırlamamışdılar. Mahmud paşa zəfər bayraqlı bahadırlardan [ibarət] bir dəstə ilə dənizin üzündən top və dig (qazan)[1234] zərbəsi ilə qala divarını ələk kimi deşik-deşik etdi. Qurudan isə Urumeli (Rumeli) dilavərləri qalaya tərəf üz qoydular. [Qalanın] içindən və bayırından ox və tüfəng aşağıya və yuxarıya atılmağa başladı.

Beyt

“Tüfəng fəvvarə kimi baş qaldırdı,
Bütün bürclərə atəş düşdü”.

Rum və Firəng qalalarının mühafizləri arasında belə bir ənənə var ki, pis əməlli düşmənlər öz hallarını elan etməkdən ötrü qalanın hündür yerində bir fənər yandırarlar və qala əhli düşdüyü çətinliyin və iztirabın qədərinə uyğun olaraq, fənərin işığını azaldıb-çoxaldarlar. Bu əlaməti yeddi dəfə uzaqdan gördükdə köməyə gələrlər. Döyüş əsnasında qala camaatı öz xəyalını və halını dənizdə olan qoşuna bildirmək üçün fənər yandırdı, ənənəvi qaydada fənərin işığını azaltmağa başladı. Lakin firəng ordusu həmin əsir xidmətkarın sözünə inanıb, alışmış fənər işıqlarını qala əhlinin səbirsizliyi kimi başa düşdü.

O əsnada Mahmud paşa dəniz qoşunu ilə dağı bürüyən sel kimi divarın deşiklərindən keçib qalanın içinə daxil oldu. Onlar iti qılınc zərbəsi ilə o yaramaz dinsizlərin damarını qopardılar. Səhra (quru) tərəfdən də igid mücahidlər tədbir kəməndləri ilə hasarın üstünə dırmanıb, qalanın içinə daxil olaraq qan tökməyə və mərdlik etməyə başladılar. Lənətəgəlmiş kafirlər qalanın fəth edildiyindən xəbər tutduqda, təlaşa qapılaraq öz diyarlarının yolunu tutdular və o Firəng kafirlərinin başçısı qeyrətsiz və adsız-sansız şəkildə Firəng darülmülkü olan Venedik şəhərinə qədər heç yerdə dayanmadan hərəkət etdi. Rum ordusunun əlinə çoxlu mallar düşdü. Sultan da beşdə birini onlara (əsgərlərə) bağışladı. Ondan sonra Rum sultanı öz mötəbər adamlarını həmin qalada qoyub İstanbul tərəfə qayıtdı.

---

[1230] Venesiya padşahı ifadəsi yanlışdır. Çünki Venesiya respublika quruluşuna malik olub, 10 nəfərlik şura tərəfindən idarə olunurdu və şuranın sədri “doj” titulu daşıyırdı *(Nəvai, şərhlər, s.729).*

[1231] Venesiya donanmasının komandanı Nikolo da Kanale nəzərdə tutulur *(Nəvai, şərhlər, s.729).*

[1232] Ağrıboz (Eğriboz) – Egey dənizində Yunanıstana aid bir ada. Yunanıstanın materik hissəsindən dar bir boğazla ayrılır.

[1233] Hücum, ani olaraq, 25 iyun 1470-ci ildə başladı *(Nəvai, şərhlər, s.730).*

[1234] Qazan termini ilə qala döyən iri toplar nəzərdə tutulur.

Həmçinin bu il sultan Qaraman hakimi Əhməd paşanı çoxlu ordu ilə Alanya[1235] diyarını fəth etməyə göndərdi. O diyarın hakimi Səlcuqilər sülaləsi hakimlərinin qalıqlarından (davamçılarından) olan Qılıc Aslan idi. O, Sultan Məhəmmədin dərgahına bir ərizə göndərib bildirdi: "Mənim nə həddim var ki, sultana qarşı müxaliflik edim?! Mən Alanya şəhərini ali məqamlı hökmdarın dərgahının mülazimlərinə təslim edirəm".

Şeir

"Sənin qəzəbinin bəlası hər yerdə bir nəsilə son qoyar,
Kafura zəhər təbiətinin qüvvəsini verər.
Sənin məiyyətinin tozu hansı yerə qonarsa,
Torpağından və daşından qiyamət gününün qoxusu gələr".

Ondan sonra [Qılıc Aslan] savaşsız və döyüşsüz surətdə o diyarı təslim edib sultanın dərgahına yollandı. Sultan onun məmləkətinin əvəzində Rum diyarında yerləşən Gümülcinə şəhərini[1236] ona verdi. Adı çəkilən şəxs cövhərşünaslıq elmində tam məharət sahibi olduğundan sultan, əndamında bir az qüsuru olan qiymətli bir daşı ona verdi ki, onu qaydaya salsın. Qılıc Aslan bəy o cövhəri götürüb Misirə qaçdı. Bir müddətdən sonra orada onu bəyənilən bir şəkildə düzəldərək layiqli töhfələrlə birlikdə sultanın hüzuruna göndərdi. Əhməd paşa həmin daşı sultanın yanına aparıb dedi ki, bu daşı satırlar. Sultan [həmin daşı] tanıdı. Qılıc Aslan bir müddətdən sonra Misirdən Əcəm diyarına yollandı və orada dünyadan köçdü.

## Azərbaycan və İraq diyarında baş vermiş hadisələr haqqında söhbət, Cahanşahın oğlu Həsənəlinin Həmədan tərəfə getməsi və onun Həsən padşah Türkmanın zəfər nişanlı əsgərlərinin əli ilə öldürülməsi

Bu ilin əvvəllərində[1237] cahan padşahı (Həsən padşah) Muğan qışlağından çıxıb köçə-köçə Ərdəbilə yönəldi. Böyük oğlu Uğurlu Məhəmmədi Osman bəy, Əlixan bəy Cahangir[1238], Müzəffər, Şahmənsur [ibn] Şahsüvar, Söhrab bəy və Şeyx Həsən Pornak kimi adlı-sanlı əmirlərlə on min nəfər qorxmaz süvari ilə murdar ("napak") Həsənəlini dəf etməyə göndərdi. Çünki o, Həmədan şəhərini istila etmişdi.

Həsənəlinin əhvalının şərhi belədir ki, Sultan Əbu-Səid Qarabağa hərəkət edərkən Həsənəlini Təbrizə göndərmişdi. Sultan Əbu-Səid əcəl saqisinin əlindən ölüm qurtumu içdiyi üçün Həsənəli Həmədana yönəldi. Təqribən altı min süvari onun bayrağının kölgəsinə toplandı. Həsənli onların varlığından güc alıb Həmədan tərəfə hərəkətə gəldi. O zaman Şah Veys [ibn] Hacı Piri, qardaşı Şah Məhəmməd və Cahangir [ibn] Şah Hacı, Həsən padşahın fərmanı ilə o diyara hakim gəlmiş Əhməd bəy Əhmədlü ilə ittifaq halında şəhərdən çıxıb Həsənəlinin qarşısında səf çəkdilər. Çox ağır bir müharibə baş verdi. Onlar Həsənəlinin sağ və sol cinahlarını dağıtdılar. Həsənəli igidlik meydanına yol tapanlardan [ibarət] bir dəstə ilə əmirlərin mərkəzinə həmlə etdi. Onlar bu hücuma tab gətirməyib qaçış yolunu tutdular. Həsənəlinin qoşunu onları təqib edib Şah Veys bəyi və Əhməd bəy Əhmədlünü təqribən altı yüz nəfər əsgərlə birlikdə qətlə yetirdilər. Cahangir canının qorxusundan özünü Həmədan qalasına saldı. O əsnada Uğurlu Məhəmməd qəflətən o dövlətsizin üzərinə hücum etdi və çoxlu döyüşdən sonra onu əsir alaraq yoxluq diyarına yola saldı.

Həsən padşah, Uğurlu Məhəmmədi İraq tərəfə göndərdikdən sonra Bistamın oğlu Əmir Bayəzidin oğlu Əli bəyi böyük əmirlərlə birlikdə Şindan qalasını[1239] fəth etməyə yolladı. O diyarın valisi olan Əmirə Sultan elçilər göndərib aman istədi. Həsən padşah, Şeyx Cəfər Səfəvinin xahişinə görə onun günahından keçib Əli bəyi geri çağırdı.

Ondan sonra Həsən padşah zilhiccə [ayının] əvvəllərində (12.06.1469)[1240] Təbrizə gəlib, Qurban bayramının ardından Təbrizdən döndü və öz ordusuna qoşularaq cah-calalla Həmədanda yerləşdi. Ondan sonra köçə-köçə İsfahana yönəldi. Böyüklər və əyan-əşrəflər [onu] qarşılamağa tələsib rəğbətin və ehsanın çoxluğu ilə baş ucalığına nail oldular. Savəri və peşkəşi qarışqa ayağı kimi Süleymanın hüzuruna daşıdılar.

[1235] Alanya – Türkiyənin Aralıq dənizi sahilində şəhər.
[1236] Gümülcinə (Kumulcina) – indiki Yunanıstanın şimal-şərqində, Rodop dağının cənub ətəklərində yerləşən Komotini şəhəri.
[1237] "Kitabi-Diyarbəkriyyə"yə görə, h. 873-cü ilin şəvval ayının əvvəllərində = 14.04.1469 *(Nəvai, şərhlər, s.733).*
[1238] Osman və Əlixan, Uzun Həsənin qardaşı Cahangirin oğulları idilər *(Nəvai, şərhlər, s.733).*
[1239] Şindan (Sindan) – Azərbaycanın Astara rayonunda tarixi qala.
[1240] Burada h. 873-cü ilin zilhiccə ayı nəzərdə tutulmuşdur.

[Həsən padşah] oradan köç edib [İsfahanın] böyüklərini geri göndərdi. Yəzdxas ətrafında xəbər çatdı ki, Əbu-Yusif mirzə Şirazı tərk edib Kirman tərəfə yollanmışdır. Ona görə də [Həsən padşah] Uğurlu Məhəmmədi onu dəf etmək üçün göndərdi və özü cah-calalla Şirazda yerləşdi.

**Cahanşah padşahdan sonra Əbu-Yusif mirzənin əhvalı haqqında söhbət**

Sultan Əbu-Səid qətlə yetirildiyi zaman Əlişəkər bəyin oğlu Pirəli, Əbu-Yusif mirzəni səltənətə yüksəldib Həmədana yola düşdü. Mahmud bəy Ağqoyunlu və Həsənəlinin oğlu Sultanəli onlara qoşuldu. İyirmi gündən sonra Sultanəlini qətlə yetirdilər. Həmədan hüduduna daxil olduqda xəbər gəldi ki, Luri-Kuçek (Kiçik Lur)[1241] hakimi Şah Hüseyn Həmədana basqın edib, Şəhrizurda Bahar ulusu üzərinə həmlə edərək onları qarət etmişdir. Ona görə də qələbə nişanlı şahzadə onların üstünə sürətli yürüş edib, qəflətən ona hücum etdi və Şah Hüseyni mülazimlərindən beş yüz nəfərlə birlikdə qətlə yetirərək Həmədandan Cürbadəqana yollandılar. Həmin şəhərdə hədsiz-hesabsız qarət və dağıntı törətdilər. [Əbu-Yusif mirzə] Mahmud bəy Ağqoyunlunu Nain, Ərdistan[1242], Əbərquh və Yəzdə basqın etməyə göndərdi, özü isə oradan köçə-köçə Şiraza yola düşdü. Bir neçə gün Şirazda qaldı. Həsən padşahın [gəlişi] xəbərini eşitdikdə Xorasana yönəldi. O əsnada Uğurlu Məhəmməd onun üzərinə həmlə edib, onu əsir alaraq rəbiüssani [ayının] (08.10-05.11.1469) ortasında qətlə yetirdi. Onun cəsədini Şiraza gətirdilər və Mövlana Nəim Kirmaninin civarında dəfn etdilər. Əlişəkərin oğlu Pirəli xilas olub Xorasana yollandı. Uğurlu Məhəmməd çoxlu qənimətlərlə və saysız mallarla Şirazda atasının ordusuna qoşuldu.

Həsən padşah iki aydan sonra Şirazdan Quma yönəldi. İsfahanın ətrafı cahan padşahının dayanacaq yeri olduqda, şəhər camaatı silahlanaraq [onu] qarşılamağa tələsdilər. Bu vəziyyət hökmdarın xoşuna gəlmədi. Hökmdar fərman verdi ki, Əmir Nemətulla Sani ali taxtın ətəyinə gəlsin. Həsən padşah istəyirdi ki, mirzəni (Əmir Nemətulla Sanini) alçaltsın və onun nikahlı arvadı olan Cahanşahın qızına işgəncə versin. Lakin axırda bu fikrindən vaz keçib ona böyük hörmət göstərdi. Şiraz hakimliyini Əmir bəy Mosulluya verdi. Özü cah-calalla İlyas Xocanın evlərində qaldı və İsfahan hakimliyini oğlu Sultan Xəlilə tapşırdı. Əmirlərin, dövlət ərkanının və həzrətin xas adamlarının hər biri qış ehtiyaclarının tədarük edildiyi bir evdə yerləşdilər. Hər çaharşənbə günü [Həsən padşah] evin qarşısında qurulmuş səltənət taxtında əyləşib camaatı qəbul edirdi. Qorunan məmləkətlərin (məmaliki-məhrusə) şikayətçiləri (ədalət istəyənləri) o gün öz ehtiyaclarını ərz edirdilər və öz məqsədlərini hasil edir, öz mətləblərinin vüsalına yetirdilər. Qışın üç ayı və baharın iki ayı bu minvalla keçdi. Hər cümə axşamı ədalət təyinatlı taxtın ətəyinə gəlmiş seyidləri, alimləri, böyükləri və əyan-əşrəfləri hökmdarın məclisinə dəvət edirdilər və orada hazır olanların qulaqları lətifliklərin və moizələrin faydaları, salehlərin və seçkinlərin zikri ilə zinətlənirdi.

Bu qışlaqda aləm akinlərinin şahzadəsi, xilafət sədəfinin dürrü Sultan Xəlil Bahadır cahanın pənahı olan dərgaha mülazimlik etdi (atası Həsən padşahın hüzurunda oldu). Nəhayət, günəş Qoç bürcünə daxil olduğu zaman (mart, 1470) xaqan həzrətləri Həsən padşah ona izin verdi ki, öz iqtası olan Qəzvinə yola düşsün, öz səadətli qədəmlərinin uğuru ilə oranın sakinlərinə himayə bayrağının kölgəsi altında yer versin və xassə qoşununu yaraqlandıraraq, müzəffər ordugah harada olarsa, cahana himayədarlıq edən bayrağın qanadlarının kölgəsi altına yetişsin. İtaəti vacib olan fərmana əsasən, o, Qəzvinə yönəldi, bir aydan sonra cahanın pənahı olan dərgaha qayıtdı və hələ Həsən padşahın bayraqları Qum şəhərindən yaylağa getməmişdən öncə [padşahın] üzəngisini öpmək izzətinə nail oldu. Öküz bürcünün 8-ci günündə (aprel, 1470) qarşısında cahanın müti olduğu əmrə əsasən, Yadigar Məhəmmədə kömək etməkdən ötrü [Sultan Xəlil] öz xassə qoşunu və digər əmirlərlə birlikdə Xorasana yönəldi. Bu zaman aləm sakinlərinin şahzadəsi Zeynal mirzə ona tiyul olaraq verilmiş Kirmanda qışlaq etdi.

---

[1241] Luri-kuçek (Kiçik Lur) – İranın Luristan vilayətinin şimal-qərb hissəsi bu cür adlanırdı *(Qızılbaşlar tarixi, s.44).*

[1242] Nain və Ərdistan – İranın mərkəzi hissəsində, Yəzd – Kaşan yolu üzərində yerləşirlər.

### Bağdadın fəthi haqqında söhbət

Həsən padşah Bağdaddan köç etdiyi zaman Pir Məhəmməd Alpavutun həyat gəmisi ölüm Dəcləsində qərq oldu və Zeynal Baratlının[1243] oğlu Hüseynəli həmin şəhəri ələ keçirib Pir Məhəmmədin qızını özünə nikahladı. Bir neçə gün sonra o da hərəkət bayrağını axirət tərəfə qaldırdı və qardaşı Şah Mənsur onun yerinə keçdi. Bağdadlılar şəhəri Həsən padşahın oğlu Maqsud bəyə təslim etdilər. Şahzadə Şah Mənsuru bəzi dostları ilə birlikdə qətlə yetirdi. Bu xəbər Qumda Həsən padşaha çatdı. O, çox sevincək və şad oldu.

### Kürdüstan qalalarının fəthi haqqında söhbət

Həmçinin bu il padşah, Cahangir mirzənin oğlu Sultan Həmzəni beş min süvari ilə Cəzirəni fəth etməyə göndərdi. Onlar Saq qalasını ələ keçirib Kürsi qalasına yollandılar. O qalanın hakimi olan Bədir bəy[1244] zərurət üzündən qalanı təslim etdi.

Həmçinin bu il Həsən padşah, Süleyman bəy Bicəni Aslan bəy Zülqədər, Əhməd bəy, İsfəndiyar bəy, Elaldı bəy Çepni, Əmir [Məhəmməd] bəy Səədlü və Sarı Pirəlinin oğlu Əmircan Səədlü kimi bir sıra böyük əmirlərlə və beş min süvari ilə Bitlisi ələ keçirməyə göndərdi. Oranın valisi İbrahim bəy öz anasını çoxlu töhfələrlə ali mənşəli padşahın dərgahına göndərib aman istədi. Ona görə də o həzrət onun günahından keçib hökm etdi ki, əmirlər o qalanın ətrafından köç etsinlər.

Həmçinin bu il Sufi Xəlil Mosullunun oğlu Cəmşid bəy, Həsən padşahın fərmanı ilə Şəki diyarına basqın edib istila bayrağını yüksəltdi.

Həmçinin bu il Həsən padşah, Sufi Xəlil Mosullunu, Süleyman bəy Pornakı, Cəmşid bəyi, Əli bəy Ağacərini və Söhrabı ucsuz-bucaqsız bir ordu ilə qaramanlıların[1245] üstünə göndərdi. Çünki Bəxtiyar Qaramanlı cəhalət və nadanlıq ucbatınan Həsənəlini qaçırmış və Həsən padşahın mülazimlərinə təslim etməmişdi. Sufi Xəlil qəflətən onların üzərinə həmlə edib, Bəxtiyarı mülazimlərindən iki yüz nəfərlə birgə qətlə yetirərək onların başlarını aləmin pənahı olan dərgaha göndərdi.

### Ölümlər

Həsənəli ibn Cahanşah padşah ibn Qara Yusif ibn Qara Məhəmməd ibn Törəmiş ibn Bayram Xoca. Həsənəli bariz dəlilikdən tamamilə bəhrəsini almışdı. O, öz əmirlərinin və inaqlarının arvadlarını toplayaraq özü onların arasında otururdu, qadınlara rəqs etməyi buyururdu və hansı birinə meyli düşsəydi, onunla yaxınlıq edirdi. Əgər kiməsə qəzəblənsəydi, onun arvadını zorla boşadardı və iddə dövrü[1246] bitməzdən öncə onu başqası ilə evləndirərdi. Atların yalını və quyruğunu kəsərdi və hökm edərdi ki, qadınlar baldırları açıq halda [həmin atlara] minsinlər. Yuxarıda qeyd edildiyi kimi, bu il o, öldürüldü. Bu sülalədən (Qaraqoyunlulardan) dörd nəfər səltənət sürmüşdür: Qara Yusif, İsgəndər, Cahanşah və Həsənəli. Onların səltənətlərinin müddəti altmış üç il olmuşdur. Məmləkətləri Azərbaycan, İraqi-Ərəb, İraqi-Əcəm və Fars idi.

Əmir Seyid Əli Bağdadi, Pirbudaq mirzənin mülazimlərindən idi. Cahanşah padşah Bağdadı ələ keçirdikdə, Seyid Əlini Təbrizə gətirib Şiraza hakimlik etməyə yolladı. Cahanşahın qətlindən sonra o, bütün Fars diyarına sahiblik etdi. Sultan Əbu-Səid İraqı istila etdikdə, Mövlana Məhəmməd Sahibi-Kəşfi Seyid Əlinin yanına göndərib onu dərgaha çağırdı. Mövlana Şiraza çatdıqda, Seyid Əli Şiraz hakimliyini ona təhvil verib Qivaməddin Məhəmmədi itaətkarlıq mərasimi üçün sultanın dərgahına yolladı. Sultan Əbu-Səidin qətlindən sonra Əbu-Yusif mirzə Şiraza yönəldi. Onun ümidi bu idi ki, Seyid Əli ona yardım edəcək və onun səltənətinə razı olacaq.

Həmin zaman Əmir Seyid Əli öz oğlu Əxi Fərəci Kirmana göndərmişdi. Əbu-Yusif mirzə İsfahandan keçdikdə, Seyid Əli fərar edərək Kirmana yönəldi və öz oğlu Əxi Fərəci Əbu-Yusif mirzə ilə döyüşə göndərdi. Onun mülazimləri fərar edib Əbu-Yusif mirzəyə qoşuldular. Ona görə də Seyid Əli Kirman tərəfə

---

[1243] "Əhsənüt-təvarix"də Zeynal Bərati (Baratlı) yazılsa da, "Kitabi-Diyarbəkriyyə"də Zeynal Bərani (Baranlı) deyə qeyd edilmişdir *(Nəvai, şərhlər, s.737).*

[1244] "Kitabi-Diyarbəkriyyə"də adı Bədru bəy ("Bədru" – "pis üzlü" deməkdir) kimi yazılmış bu adam Əmir Abdal oğullarından olan Cizrə hakimi Əmir Bədirdir *(Öztürk, şərhlər, s.492).*

[1245] Burada Qarabağ qaramanlıları nəzərdə tutulur (bax: *F.Sümer. Kara Koyunlular, s.26-27*).

[1246] İddə dövrü – şəriətə görə, əri ölən və ya ərindən ayrılan qadının yenidən ərə getmək üçün gözləməli olduğu müddət.

döndü. Əbu-Yusif mirzə tərəfindən Əlişəkərin oğlu Yarəli min nəfər yaxşı silahlanmış süvari ilə Kirmana yönəldi. Seyid Əli Yəzd tərəfə fərar edib, oradan yola çıxaraq İsfahanda Həsən padşahın dərgahına getdi. Əbərquhda ondan şikayət etdikləri üçün Həsən padşah onun dara çəkilməsinə fərman verdi. Dara çəkilən zaman Əbərquh əhalisi onu daşqalaq etdi.

## 875-Cİ İLDƏ (30.06.1470 – 19.06.1471) BAŞ VERMİŞ HADİSƏLƏR

### Sultan Hüseyn mirzənin Zağan bağına gəlişi və Yadigar Məhəmməd mirzənin öldürülməsi

Yadigar Məhəmməd mirzənin qəflətdə olması xəbəri dəfələrlə Sultan Hüseyn mirzənin qulağına çatdıqdan sona o, Meymənədən Herat tərəfə sürətli yürüş etdi. Baba Xakinin mənzilinə çatdıqda, vəcd sahiblərinin rəhbəri [Baba Xaki] onu qarşılamağa çıxıb o cənaba bir kümac (şirin çörək) və bir qoyun təqdim etdi və onu şəhərə getməyə həvəsləndirdi.

O əsnada bundan öncə dil tutmaq üçün Herata getmiş Şirəm Qaravulun yanından, Heratdan etibarlı bir adam gəlib ərz etdi:

- Xiyabanın başına qədər getdim, bəzi adamlardan sorğu-sual etdim və Yadigar Məhəmmədin vəziyyətini soruşdum. Cavab verdilər ki, şəhərdə heç bir tərəfdən xəbər yoxdur və Mirzə Yadigar Məhəmməd əvvəlki qaydada nərgiz və lalə kimi Zağan bağında [oturub] bir anını belə qədəhsiz və piyaləsiz keçirmir.

Yadigar Məhəmməd mirzənin və türkman ordusunun qəflətdə olması haqqında xəbər yenidən Sultan Hüseyn mirzənin qulağına çatdıqda, həmin zaman qələbə nişanlı məiyyətin mülazimi olan səkkiz yüz əlli nəfər şücaətli və cəsarətli adamla mümkün olduğu qədər ən təcili surətdə sürətli yürüş edib Xəbəzduk çeşməsi keçidinin başına çatdıqdan sonra dövlətsevərlərdən birinə buyurdu ki, "qabaqcadan Zağan bağına getsin; əgər fürsət taparsa, bağın qapısını sındırsın, əgər mümkün olmazsa, zamanın tələbinə uyğun davransın". Onun ardınca Əmir Müzəffər Barlası, Əmir Şeyx Əbu-Səid Candərmiyanı, Əmir İbrahim Barlası, Dərviş Əli Orlatı və digərlərini təqribən yüz əlli nəfərlə birlikdə yola saldı. Şərt kəsdi ki, əgər qapını açmaq mümkün olarsa, bu müjdəni çatdırmaqdan ötrü təcili surətdə bir qasid göndərsinlər və geri dönüb Qərənfil çeşməsində müzəffər üzənginin hüzuruna gəlsinlər. Gecə göy üzünə qara libas geydirdi.

Beyt

"Bijən quyusu kimi dar və qaranlıq bir gecə,
Bijən kimi onun quyusu içində dustağam mən"[1247].

Dünyanı tutan sultan qalan mülazimləri ilə ahəstə-ahəstə, mükəmməl təvəkküllə, qərarlaşdırılmış şəkildə Qərənfil çeşməsi nahiyəsində dayanmayaraq Xiyaban küçəsi yolundan kamına və arzusuna çatmış halda Zağan bağı tərəfə hərəkət etdi.

Beyt

"İzzət və dövlət sağında, fəth və zəfər solunda,
Cah-calal və həşəmət yüyəninin, bəxt və səadət üzəngisinin yanında".

Bu əsnada Yadigar Miraxur, Əmir Müzəffərin qabağına gəlib bağın qapısının sındırılması xəbərini ərz etdi. [Sultan Hüseyn mirzə] Əmir Mübarizəddin Vəli bəyi və Əmir Nasirəddin Əbdülxaliqi Əmir Əli Cəlairin məskəni olan Əmir Cəlaləddin Firuzşahın evinə göndərdi ki, əgər adı çəkilən şəxs müqavimət göstərərsə, ona qarşı tədbir görsünlər. Doləng Özbəyi özbəklərdən [ibarət] bir dəstə ilə bağın Gövhərşad bəyimin cümə məscidinə yaxın olan qapısına yolladı və Mirzə Kiçiyə böyük darvazada gözləməyi əmr etdi. Səltənət sahibi olan həzrət (Sultan Hüseyn mirzə) Mirzə Sultan Əhmədi bağın Əbül-Vəlid məzarı istiqamətindəki qapısını zəbt etməyə təyin etdi. Daha sonra uğurlu və qalibiyyətli padşah özünün Bəhram kimi intiqamçı xidmətçilərindən səksən nəfərlə Zağan bağına daxil oldu.

Beyt

"Ünsür bağının qılınc sıyırmışları,
Qılıncın üstünə yazmışdılar: Ya Rəbb, kömək et!"

---

[1247] Bijən – İran mifologiyasına görə, məşhur qəhrəman Zal oğlu Rüstəmin bacısı oğludur. O, Əfrasiyabın qızı Münijəyə aşiq olduğu üçün Əfrasiyab tərəfindən bir quyuya həbs olunmuş, lakin Münijənin yardımı ilə Rüstəm tərəfindən azad edilmişdir.

Əmir Əlişirin məsləhəti əsasında o, Tanrının köməyi ilə dərhal Şimal bağına irəlilədi. Lakin gözlədiklərinin əksinə olaraq, daha öncə oraya hərəkət etmiş əmirlərdən və əsgərlərdən heç kəsi görmədilər. Çünki vahimə və xof o camaata qalib gəlmiş, hər biri bir guşədə gizlənmişdi. Hətta hökmdarın üzəngisini müşayiət edən adamlar da bir-bir qaçıb ağacların arxasında gözdən itirdilər. Xülasə, uğurlu sultan Qəsri-Qədim (qədim qəsr) çevrəsində bir çadır müşahidə etdi və bəzi məxsusi adamlarına işarə etdi ki, çadıra daxil olsunlar. Ümidi bu idi ki, bəlkə, Yadigar Məhəmmədi orada taparlar. Sultan həzrətlərinin yaxın adamı olan Əmir Əlişir cəsarət ayağını irəli qoydu və həmin zaman nökəri olan Əmir Baba Əlini çadırın içinə göndərdi. Adı çəkilən əmir çox axtarsa da, Yadigar Məhəmməd mirzədən bir nişan tapmayıb geri döndü. Sultan həzrətlərinin yaxın adamı olan cənab (Əmir Əlişir) əlahəzrət xaqana qoşuldu və onlar birlikdə köşkün qapısına getdilər. Sultan Hüseyn mirzə mülazimlərinə yuxarı çıxmağı əmr etdi. Lakin heç kəsdən bir cavab eşitmədi. Çünki onları bürümüş vahimənin çoxluğu üzündən onlar bir-birilərindən ayrılmırdılar.

Axırda Əmir Əlişir əsa yerinə qılıncı əlində tutub yuxarı qalxdı. Əmir Qul Əli və bəziləri digər bir yoldan qəsrin başına çıxdılar. Mehtər İsmayıl Fərraş bağdan kənara çapıb, bir neçə şam yandıraraq gətirdi. Hacı Əli Piyada, Mirzə Yadigar Məhəmmədi əsir aldı. Aşağı enərkən Əmir Qul Əli şahzadəni ondan alıb, Əmir Əlişirin qalxdığı yolla aşağı gətirərək Sultan Hüseyn mirzənin nəzərinə çatdırdı.

Beyt

“Sənə kim dedi ki, eyş-işrət bağında və ərköyünlük taxtında,
Gecələr şərab iç, səhərlər isə yat?!”

Qəhredici qəhrəman onun qətlinə fərman verdi. Qəddar ruzigarın halının nəticəsi və dövr edən zülmkar fələyin oyunu budur. Onun şamının şəfəqi günahsızların qanına bələnib və onun sübhünün dan yeri məzlumların nəfəsindən doğulub.

Türkman əmirləri bu xəbəri eşitdikləri zaman onların bir qismi Zağan bağında, bəziləri isə Zübeydə bağında[1248] məskən salmışdılar. Onlar İraq yoluna çıxdılar. Sultan Hüseyn mirzə səltənət taxtında əyləşdi və Yadigar Məhəmmədin böyük əmirlərindən olan Əmir Əli Cəlairi qətlə yetirdi.

Bu xəbər Həsən padşahın qulağına çatdıqda onun qəzəb atəşi alovlandı. O, Uğurlu Məhəmmədi çoxlu ordu ilə Astarabad tərəfə göndərdi və buyurdu ki, “əsgərlər Reydə qışlaq etsinlər, çünki baharda özüm şəxsən Xorasana yürüş edəcəyəm”. Bu əsnada Şeyx Əbu-Səid ibn Əbülxeyr övladlarından olan Şeyxülislam Abdulla elçi kimi Sultan Hüseyn mirzənin yanından gəlib bir məktub gətirdi. Məzmunu belə idi:

“İndiyə qədər doğru əqidəyə sadiq olan bu xeyirxah müxlisdən vəfa, uzlaşma və dürüstlük yolunda irəliləməkdən, dostluq və ittifaqın düzgün istiqamətində yürüməkdən savayı bir iş baş verməmişdir. Hərçənd siz tərəfdən dəfələrlə hər biri əhd-peymanın qırılmasına qəti bir dəlil və aydın bir sübut olan əməllər və davranışlar baş versə də, bu müxlis özünü görməməzliyə vurmuşdur.

Əvvəla, cənabınız şəhid Sultan Əbu-Səidin qətlini caiz bildi və xilafət məqamlı bu xanədanın yüz illik hüququnu bütünlüklə unutdu. Biz əsla buna iltifat etmədik. Amma yenə də elçi və məktub göndərdik ki, bizim tərəfimizdən bir saç tükü qədər müxalifliyin olduğu sezilməsin. [Siz isə] Yadigar Məhəmməd mirzəni izdihamlı bir ordu ilə bu tərəfə göndərdiniz. Lakin o, qarşıdurma olmadan fərar etdi. Biz köhnə münasibətlər üzündən bu hadisəyə də əhəmiyyət vermədik və dostluğun doğru yolundan kənara çıxmağı münasib bilmədik. Hətta siz yenidən adı çəkilən əmirzadəni çoxlu qoşunla bu tərəfə göndərdiyiniz zaman cənabınızın nökərləri bizim qaravullarımıza əsir düşdükdə, onlar növbənöv qəzəbə və cəzaya layiq olsalar da, biz onlara hörmət gösrərib sizin hüzurunuza geri göndərdik. Yadigar Məhəmməd mirzə qətlə yetirildikdən sonra əsir düşmüş Yusif bəyi, Şahmənsuru və digər bayandurları sağ-salamat dərgahınıza yolladıq. Belə bir yaxşılığın əvəzində onlar bu mühibbin vilayətindən keçərkən öz xoşagəlməz adətlərinə əməl edərək talan və tarac etməkdən əl çəkmədilər. Bundan başqa, Bistam və Damğan qədimdən Xorasan məmləkətinə daxil olsa da, onları tələb etmədik. Cənabınız isə bunun qarşılığında həmin vilayəti bizim qiyamçı, üsyançı və tüğyançı nökərimiz olan Şeyx Cəlairə verdi. Biz bunu da qəbul etdik.

Bundan başqa, pis davranışlardan biri də Kirman əyalətinin idarəçiliyinə təyin etdiyiniz Ömər bəylə Osman bəyin qeyri-mülayim hərəkətləridir. Onlar Xorasanın sərhədində yerləşən Xusəf və Sərçaha gələrək

[1248] Zübeydə bağı – hal-hazırda Heratın 1 mil qərbində yerləşir *(Nəvai, şərhlər, s.129).*

müsəlmanların mallarını qarət etmişlər. Hərçənd mən səmimi bir dost olaraq, çinar kimi səbir və vüqar ayağını ətəyimə çəksəm də, onların sultanların öhdəliklərinə riayət etmələrini təmin etmək vacib və lazımdır. Əgər bunlar cənabınızın razılığı və fərmanı ilə baş vermişdirsə, belə bir qərarı qəbul edərkən hansı hikmətə və məsləhətə əsaslanmışsınız? Əgər məqsədiniz öz qüdrətinizi və şövkətinizi göstərməkdirsə, nurlu qəlbinizdən gizli deyildir ki, bizim Ulu Yaradanın dəstəyinə o qədər etimadımız və ümidimiz vardır ki, nəinki bu kimi xırda hadisələr, hətta böyük hadisələr qarşısında belə zəiflik, süstlük, acizlik və qüsur bizim xoşməramlı könlümüzdə baş qaldırmağa macal tapmaz. Əgər bu hadisələr sizin istəyinizlə baş verməyibsə, o zaman münasibdir ki, bu əməlləri törədənləri ədalət və insafın zərurətinə uyğun surətdə layiqli cəzaya çatdırasınız və müvafiq şəkildə tənbeh edəsiniz. Əks təqdirdə, Ulu Yaradanın əmri ilə məkrlərin və zərərlərin dəf edilməsi bizim dövlətimizin doğru görən rəyi üçün yetərincə asandır. Əgər bir kəs din və dövlət sahiblərinin, mülk və millət başçılarının fəaliyyəti üçün zəruri məsələlər olan zalımlığın dəf edilməsinə və qanunsuzluğun ortadan qaldırılmasına çalışmasa, vacib əməllər cümləsindən olan müsəlmanların malının və halının qorunmasına riayət etməsə, onların arvad-uşaqlarına himayə göstərməsə, Yaradanın və yaradılmışların nəzdində töhmətlənmiş və qınanmış kimsədir. Üzrlü hesab edin. Mətləbi uzatmağa ehtiyac görmədik. Həzrətinizin dövlətinin əhdi və müddəti, iqtidarınızın dövrü və zamanı nöqsan və zaval eybindən, vahimə səmtindən hifz və qorunma altında olsun".

Həsən padşah elçiyə böyük hörmət göstərib öz dövlətyar övladlarının adına hökmdar fərmanı (nişan) yazdırdı. Məzmunu belə idi: "Astarabadı Sultan Hüseyn mirzənin təyin etdiyi adama təhvil versinlər və əsgərlər o hüduddan elə çıxsınlar ki, rəiyyətə onların keçidindən bir zərər dəyməsin". Həmin fərmanı Qazı Əlaəddin Əli [vasitəsilə] şeyxülislamla birlikdə, töhfələr və hədiyyələrlə bərabər Sultan Hüseyn mirzə üçün yolladı. Həmçinin Heratın alimləri, əyanları və böyükləri üçün ənam olaraq çoxlu töhfələr və hədiyyələr göndərdi.

Elçinin, məktubların və hökmdar fərmanının yetişməsindən sonra o diyarın əhalisinə böyük bir sevinc üz verdi. Qazının gəlişi şərəfinə ona layiqli hörmət, ehtiram və lütkfarlıq göstərərək, əhd-peyman bağladıqdan sonra ona geri qayıtmaq üçün icazə verdilər. Şahzadələr və böyük əmirlər itaəti vacib olan fərmana əsasən, Astarabaddan və onun ətrafından köçə-köçə İraqa yönəldilər və sözügedən ilin bahar fəslində, zilqədə [ayının] əvvəllərində (21.04.1471) Həsən padşah yayı keçirmək üçün Qum qışlağından Savuxbulağa getdiyi zaman ali ordugaha qatıldılar. Şahzadələrdən hər biri izin alaraq öz əyalətlərinin mərkəzinə döndülər.

Bu il Rum padşahı Sultan Məhəmməddən dərgaha bir elçi gəlib padşahlara layiq töhfələr və hədiyyələr, səmimi dostluq izhar edən, əhd-peymanı möhkəmləndirən və İraqın fəthini təbrik edən bir məktub gətirdi və məktubun cavabı ilə birlikdə geri göndərildi.

Ondan sonra Misir sultanı Qayıtbay tərəfindən bir elçi tam əzəmət və şövkətlə, nəfis töhfələr və hədiyyələrlə gələrək anlaşma, sədaqət, dostluq və vilayətlərin fəthi barəsində bəlağətli[1249] bir məktub təqdim etdi. Ona münasibətdə də hörmət və ehtiram göstərildikdən, ənam verildikdən sonra geri göndərildi.

Yəzd tərəfdən hökmdarın əmri ilə tərtib edilmiş və zinətləndirilmiş, böyük zəhmət hesabına başa gəlmiş Həcc hədiyələri (məhmili-həcc) gəlib yetişdi. Seyid soylu alicənab Nemətulla Sani islam qaydalarına ehtiram əlaməti olaraq, onu Yəzddən Quma çatdırdı. Həsən padşah şahzadələr və əmirlərlə birgə qarşılanma mərasimini yerinə yetirmək üçün şəhərdən çıxdı və şərəfli hədiyyələri (məhmili-şərif) şəhərin içinə gətirdilər. [Həsən padşah] öz qardaşı Üveys bəyi "Həcc əmiri" (əmiri-həcc) [təyin] edib, onu çoxsaylı süvarilər və piyadalar dəstəsinin müşayiəti ilə yola saldı. Həsən padşahın əmisi oğlu Xəlil bəy Pərvanəçi isə şahzadə Maqsud bəyə yardım göstərməkdən ötrü hədiyyələri aparan karvanla Bağdada göndərildi.

Həmçinin bu qışlaqda görkəmli Qaraman əmirlərindən biri zəmanə naiblərinin köməyi ilə dərgaha gəldi və belə ərz etdi:

- Rum padşahı Sultan Məhəmməd əmizadələrim olan Pir Əhməd bəy ibn İbrahim bəyə və Qasım bəy Qaramaniyə qarşı zorakılıq və istilaçılıq mövqeyindədir və onların vilayətinin əksərini ələ keçirmişdir. Pir Əhməd bəy, Sultan Məhəmmədin bibisi olan anasını Həsən padşah həzrətlərindən kömək istəmək üçün gön-

[1249] Bəlağət – fikri incə, aydın və gözəl ifadələrlə anlatmaq.

dərmişdir və məni də onun xidmətinə təyin etmişdir ki, öz vəziyyətinin şərhini hökmdara ərz etsin. Lakin yolda ikən anası haqqın rəhmətinə qovuşmuşdur.

Sonra Həsən padşah ona qayğı göstərib padşahlara layiq lütflərin civarında onu rahatlatdı. Ta o zamana qədər ki, qələbə şüarlı bayraqlar Qaraman əmirlərini dəstəkləmək üçün Qumdan Azərbaycana və Rum hüduduna tərəf qaldırıldı.

Həmçinin bu qışlaqda Həsən padşahın anabir (doöma) qardaşı olan İsgəndər bəy haqqın çağırışına "ləbbeyk" deyib əbədiyyət aləminə köçdü. Yüksək dərəcəli anası və adlı-sanlı qardaşı dünya sakinlərindən olan bidət və azğınlıq əhlinin təşəbbüs göstərdikləri xoşagəlməz əməllərə imkan verməmək üçün onun əzadarlıq mərasimini təşkil edərkən [dini] fərzlərin və sünnətin (peyğəmbər ənənəsinin) ədəb-ərkanını yerinə yetirməklə kifayətləndilər.

Həmçinin bu günlərdə [Həsən padşah] Mirzə Məhəmməd Təvaçını Rüstəmdarı fəth etmək və Çəlavilər vilayətinin qalalarını almaq üçün təyin etdi. Çünki fəthin başlanğıclnda Rüstəmdar hakimləri və Çəlaviyyə əmirləri[1250] Rey əyalətinə getmiş Darab bəyə qarşı bir neçə dəfə sui-qəsd cəhdi göstərmişdilər və ali taxtın ətəyinə gəlmək haqqında dəvətdən imtina etmişdilər. Lakin həmin hakimlər və əmirlər [Həsən padşahın] əzəmətini müşahidə etdikdən sonra kəfən və qılıncla özlərini dövlət astanasının torpağına çatdırdılar[1251], təqsirlərini əfv etdirməyə və irsi vilayətlərinin hakimiyyətini əldə etməyə nail oldular. Əmir Şahəli Bayrami, Əmir Əbu-Səid bəy İnaq və Darab bəyin oğulları fərmana əsasən çoxsaylı bir dəstə ilə Xürrəmabad qalasını fəth etməyə getdilər və Şah Hüseyn Lurun mənsub olduğu Abbasiyyə hökmdarlarına məxsus olan həmin qalanı ələ keçirdilər.

Qış sona çatdıqda, Qum qışlağından köç edib Savuxbulağ yaylağında çadır və alaçıq qurdular. Şahzadələr Astarabaddan qayıdıb bu yaylaqda büsatı öpməyə nail oldular və hər biri öz əyalətinin mərkəzinə yola düşdü. Həsən padşah həzrətləri oradan köç edib Qəzvində yerləşdi və o məmləkətin həm aşağı, həm də yüksək təbəqədən olan insanlarının könlünü alıb, öz əmri əsasında yaradılmış dövlətxanada məskunlaşaraq, ədalət istəyənlərin şikayətlərinə baxdı. Sözügedən ilin zilhiccə [ayının] 7-də (27.05.1471) oradan köç edib, Sultaniyyə və Qəzvin arasındakı yaylağa gələrək Qurban bayramını qeyd etmək üçün orada qaldı. Ərəfə günü Cəkcəki yaylağından Ərəfat[1252] kimi rəhmətin qonduğu və bərəkətin endiyi yer olan bir düzənlikdə cahcalalla dayandı. Ümumi qəbulun ardınca qurban adətinin vəzifələrini yerinə yetirdikdən və bayram namazını qıldıqdan sonra ata minərək, cahangirlik və cahandarlıq bayrağını Azərbaycana doğru qaldırdı. Əbhər ətrafında oranın cümə məscidinin təmir olunmasını əmr edib bu işin məsrəflərinin öz şəxsi (xassə) malından ayrılmasını buyurdu. Şəhərə birləşən Sultaniyyə çəməni aləmin pənahı olan padşahın dayanacaq yeri oldu. Təqribən bir həftə o məkanda qərar tutdu, Sultan Məhəmməd Xudabəndə ilə Sultan Əbu-Səidi[1253] ziyarət etdi və oranın günbəzinin və vəqflərinin təmiri üçün fərman verdi. O məqamda şahzadə Maqsud mirzə fərmana uyğun olaraq, hökmdarın düşərgəsinə qatıldı. Sonra oradan köç edib, suyuna və havasına görə cənnət bağını xatırladan Təbrizin Səhənd yaylağına gəldi. Bir neçə gün orada qalıb, 876-cı ilin məhərrəm ayının əvvəlində (20.06.1471), fərəh bəxş edən bir vaxtda səadətli tale ilə Təbriz şəhərinə cah-calalla daxil oldu. Xeyirxahlıq və yaxşılıq qapılarını o diyarın fəqirlərinin və miskinlərinin üzünə açdı. Bir neçə gün ərzində inanılmış adamların əli ilə o bölgənin ehtiyac sahibi olan alimlərinə, salehlərinə, hafizlərinə, fəqirlərinə, miskinlərinə və qarilərinə ("Quran" oxuyanlarına) çoxlu məbləğ göndərdi. Hər gün sürəkli olaraq halalxanada qurulan halal ziyafətlər və davamlı şəkildə məczubların (Allah aşiqlərinin) tacı olan Baba Əbdürrəhmanın dərvişlərindən ötrü təşkil edilən gündəlik süfrələr sayəsində fəqirlər üçün tam asudəlik hasil oldu. Hər cümə gecəsi öz ehtiyacları üçün aləmin pənahı olan dərgaha gələn ətrafın və yan-yörənin alimləri və böyükləri hökmdarın məclisinə yol tapırdılar. Comərdlik buludunun feyzindən quraqlıq və məhrumiyyət qoşunu məmləkətlərin ərazisindən qovulduqda, ətrafdakı rəiyyət cahanın pənahı olan dərgaha üz tutdu. Dikbaş sərdarlar və baş qaldıran dikbaş təbəələr də cahanın pənahı olan dərgaha üz tutdular.

---

[1250] Mazandaranda hökm sürən xanədanlardan biridir.
[1251] Kəfən və qılıncla gəlmək, itaət əlaməti idi.
[1252] Ərəfat – Məkkə yaxınlığında dağ.
[1253] Elxanilər (Hülakular) sülaləsinin hökmdarları Sultan Məhəmməd Xudabəndə (Ulcaytu xan) və Sultan Əbu-Səid nəzərdə tutulur.

Beyt

"Ona xidmət etmək həvəsi ilə başı aşağı gəlirlər,
Doğuş vaxtında analarının bətnindən tifillərin hamısı".

[Həsən padşah] bir ay Təbrizdə qaldıqdan sonra Məhmad bəy, Süleyman Pornak və Bayandur bəy kimi bəzi böyük əmirlərini iki min süvari ilə Tiflisə və Ərmən diyarına tərəf göndərdi ki, o vilayəti ələ keçirib zəbt etsinlər, oraya hökmdarın bayraqlarını sancsınlar və daha sonra oradan dünyanı fəth edən bayrağın kölgəsində Rum tərəfə yönəlsinlər.

Bu zaman Pir Əhməd bəy Qaramaninin qardaşı Qasım bəy cahanın pənahı olan dərgaha gəlib iltifat izzətinə və lütfkarlıq şərəfinə nail görülməklə iftixar tapdı. İki aydan sonra [Həsən padşah] aləmin və aləm sakinlərinin şahzadəsi Maqsud mirzənin sünnət mərasimindən ötrü darüssəltənə Təbrizdən hərəkət edib toy üçün lazım olan hazırlıqların görülməsini əmr etdi. Rəbiüləvvəl ayının əvvəllərində (18.08.1471) Təbriz şəhərindən [çıxıb], dirilik suyuna bənzəyən bir neçə min çeşməyə malik Əlvənd dağını öz laləsinə və reyhanına heyran qoyan Səhənd tərəfə getdi, oradan da sünnət toyu mərasimi üçün cah-calalla Ucan düzənliyinə qədəm qoydu. Əvvəlcə rəbiüləvvəl ayının 12-də (29.08.1471) Həzrət Mustafanın – Allahın salamı olsun ona – mövlud gününü qeyd etdi[1254]. Ümumi yemək (ehsan) verildikdən sonra Beytül-Haram hacılarının və Mədinətün-Nəbi[1255] – Allahın salamı olsun ona – zəvvarlarının qayıdışı xəbəri hökmdar ordusunda sadə və seçkin adamlara (hamıya) çatdı. Hamı karvanı qarşılamağa çıxdı. Hacıları ordugaha gətirib hamısını "Allah [bəndələrini] əmin-amanlıq yurduna (cənnətə) çağırır"[1256]ayəsinin sonsuz ehsan süfrəsinə oturtdular. İkinci dəvət də sona çatdıqdan sonra Təbrizdən çıxışın məqsədi olan şahzadənin sünnət mərasimini təşkil etməklə məşğul oldular. Oraya dəvət olunmuş əyanlardan hər biri qaydaya riayət etməkdən ötrü adlı-sanlı ərəb atlarından, sürətli və xoşrəftar qatırlardan, nəfis qumaşlardan, əmtəələrdən, Qıbrus (Kipr) yunlarından, rus kətanlarından [ibarət] hədsiz-hesabsız hədiyyələr təqdim etdilər. Ülgücü əsaya[1257] çatdırmaqda yədi-bəyza[1258] kimi iş görən (möcüzə göstərən) Həkim Musa, İbrahimin sünnətinə (ənənəsinə) uyğun şəkildə ülgücü işlətdikdən sonra səxavətlə bəxşiş vermək üçün əllər açıldı. Toy vəzifələri yerinə yetirildikdən sonra hökmdar qışlamaq üçün yenidən Təbrizə döndü. Həmin qışı könül rahatlığı ilə Təbrizdə keçirdi. Baharın əvvəllərində isə yağış damcılarından daha artıq sayda qoşunlarla Təbrizdən çıxıb cah-calalla Mərənd çəmənində dayandı. Fələyin qulamlıq etdiyi hökmdar bir neçə gün o məkanda qaldıqdan sonra ordusu və yarağı ilə birlikdə Aladağda yerləşdi.

Həmçinin bu zaman böyük və kəramətli alim Mövlana Əli Quşçu Xorasandan gəlib dənizin və qurunun hökmdarının nəzərləri qarşısına çıxdı. Ona iyirmi min Şahrux təngəsi və bir top qumaş bağışlandı.

## 876-CI İLDƏ (20.06.1471 – 07.06.1472) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Həsən padşah, Sultan Məhəmmədə qarşı düşmənçilik izhar etdi. Əhdləri pozan həmin müxaliflik bu xilafət məkanlı sülalənin qədim zamanlardan Bayandur xanədanı[1259], xüsusən Həsən padşahın atası Əli bəy Qara Osman oğlu üzərindəki ənənəvi hüququnun unudulması demək olub, haqqı tanımaq məsləyi və sərkərdəlik baxımından son dərəcə təəssüf doğuran bir hadisə idi. Çünki Osman bəyin Ağqoyunlu hakimi olmuş böyük oğlu Yaqub bəyin qorxusundan Həsən padşahın atası öz övladları ilə fərar edərək illər boyunca gözəl xasiyyətli padşah Sultan Muradın himayəsinin kölgəsində yaşamışdılar. Rum məmləkətində onlar üçün dolanacaq vəsait ayrılmışdı. Bayandur camaatından Rüstəm ibn Murad bəy ibn Osman, Rüstəm bəyin oğlu Bayandur bəy və onlar kimi bir çoxları illərlə Sultan Muradın mərhəmət kölgəsi altında, rifah içində qalmış və bəziləri öz könüllərinin istəyi ilə yenidən öz vətənlərinə və əsl məskənlərinə geri dönmüşdülər.

Sultan həmişə o tayfaya münasibətdə mürüvvətə və haqq-ədalətə riayət edirdi. Sultan öz qüdrətinin mükəmməlliyinə və o türkman qövmünün olduqca zəifliyinə və acizliyinə baxmayaraq, heç vaxt onların

---

[1254] Sünnilər rəbiüləvvəl ayının 12-sini, şiələr isə həmin ayın 17-sini peyğəmbərin mövlud günü kimi qeyd edirlər *(Nəvai, şərhlər, s.752).*

[1255] Beytül-Haram adı ilə Məkkədəki Kəbə evi, Mədinətün-Nəbi adı ilə Mədinə şəhəri nəzərdə tutulur.

[1256] *Qurani-Kərim, "Yunus" surəsi, 25-ci ayə.*

[1257] Burada "əsa" adı altında kişi cinsiyyət orqanı nəzərdə tutulmuşdur *(Nəvai, şərhlər, s.752).*

[1258] Yədi-bəyza ("ağ əl") – dini mətnlərdə və klassik ədəbiyyatda bu ad altında Musa peyğəmbərin möcüzə göstərən əli nəzərdə tutulur.

[1259] Bayandur xanədanı – Ağqoyunluların hakim sülaləsi.

mülkünü zavala uğratmağa və onların kiçik ərazisini zəbt etməyə can atmırdı. Baxmayaraq ki, Həsən padşahın Sultan Məhəmmədlə arasında köhnə əhdlər və razılaşmalar vardı və keçmiş vaxtlarda o, gücünün azlığı üzündən həmişə sürəkli və qətiyyətli qədəmlərlə itaət yolunda addımlayırdı, axırda bir neçə günlük dövlət mənfəəti ucbatından müxalifliyini izhar etdi.

Həsən padşah Əcəm məmləkətlərini tamamilə istila etdikdən, Xorasana və Herata qədər qoşun göndərdikdən sonra türkman qövmlərinin təbiətinin ənənəvi qaydasına uyğun olaraq, qərəzçilik maddələrinin və nəfsani istəklərin təhriki ilə Həsən padşahın beyninin içində fitnəkar xəyallar, şər törədən düşüncələr və fəsad yaradan niyyətlər yer tutdu. Onun əzm atı nəfs və səhlənkarlıq havasının arxasında qaldı və o, “İnsan azğınlıq edər, özünün dövlətli olduğunu gördüyü üçün!”[1260] yolu ilə gedərək baş qaldırdı. Çünki Həsən padşahın səltənətinin dəstgahı və məmləkətinin genişliyi o həddə çatmışdı ki, o da özünü “Onlara böyük mülk (hökmranlıq) bəxş etdik”[1261] zümrəsinə aid olanlardan sayırdı. Həsən padşah Azərbaycanın və İraqın fəthindən öncə Rum və Şam hakimləri tərəfindən təzyiqlərlə üzləşmiş, öz zəifliyi, yardımçılarının və dəstəkçilərinin azlığı ucbatından bu qəbildən olan düşmənlərindən növbənöv azar görmüşdü. Bu səbəbdən də o, həmin vaxtlarda şərq məmləkətlərində qisasçılıq və intiqam yolunu tutaraq, sübhün qaranlığı işıqlandırdığı kimi Şam ölkəsində özünü göstərmək və qərb tərəfdən də bir neçə ölkə almaq istəyirdi. Ona görə də qoşunu və məiyyəti ilə birlikdə Fəridun və Cəmşidin qaimməqamı (varisi) olmaq iddiası ilə Əcəm məmləkətlərindən Diyarbəkr vilayətinə qayıtdı və oradan Şam hüduduna hücum etmək düşüncəsi ilə yola çıxdı.

O əsnada Sultan Bayəzid[1262] Rumiyyeyi-Suğra[1263] məmləkətlərində hakimiyyət sürürdü. Həsən padşah onun yanına, Amasyaya bir məktub və bir elçi göndərdi və zahirən sədaqət və uzlaşmanın möhkəmləndirilməsi məsələsini ortaya atdı. Məktubun nəticəsi bu oldu ki, o həzrət (Sultan Bayəzid) əhdlərin yeniləşdirməsinin və anlaşmaların bağlanmasınının atası Sultan Məhəmmədlə həyata keçirilməli olduğunu bildirdi. [Həsən padşah] ilk addımları atdıqdan sonra fürsət tapıb qəti hərəkətə keçdi. Belə ki, daha öncə qeyd edildiyi kimi, Qaramanoğullarından Pir Əhməd bəy və Qasım bəy vəfasızlıq, tüğyan, nifaq və nankorluq ucbatından başlarını sultanın cəza qılıncından qurtarıb, böyük qardaşları İshaq bəy kimi o ali məqamlı padşahın səadətli dərgahından üz döndərərək məyusluq və məhrumiyyətlə Qaraman diyarından Həsən padşaha sığındılar və sultanın ordusu Əhməd paşanın başçılığı ilə Qaramanın bütün şəhərlərini və qalalarını ələ keçirib oranı Qaraman sülaləsinin zülm və ədalətsizlik əziyyətindən xilas etdi. Ona görə də Həsən padşah cahilanə bir hiddətə qapılıb, düşünmədən əhdi pozaraq kamandar türkmanlardan və qaniçən zalımlardan [ibarət] böyük bir ordunu o qoşunun öndəgedəni və o ölkənin böyüyü olan Əmir bəy Bektaş oğlu Mosullu ilə birlikdə Toqat şəhərinə basqın etməyə göndərdi. Onlar o şəhərdə və vilayətdə tarac və qarətə başladılar.

Beyt

“Hər tərəfdən mal-dövlət tarac etmək üçün,
Sitəm qartalını qanadlandırdılar”.

Soyğun və qarət etdikdən, vilayəti dağıtdıqdan sonra o şəhərin əhalisinin evlərinə cəhənnəm atəşi saldılar.

Bu fəsadın xəbərləri Sultan Bayəzidin qulağına çatdıqda, Amasya şəhərindən çıxıb onların üzərinə yollandı və bu xəbəri atası Sultan Məhəmmədə göndərdi. Sultan Bayəzidin gəlişi xəbəri Əmir bəyə çatdıqda, o, geri dönərək Diyarbəkrə yönəldi. Qış vaxtı Pir Əhməd bəyin və Qasım bəyin bələdçiliyi ilə Həsən padşahın qardaşı olan Cahangirin oğlu Yusifin başçılığı altında iyirmi min nəfərlik yaxşı silahlanmış və qan içən süvari qoşun Qaraman diyarına yollandı.

O əsnada atası tərəfindən Qaraman məmləkətlərinin hakimi olan Sultan Mustafa bu xəbəri atası Sultan Məhəmmədə göndərdi. Atası Sultan Məhəmməd, Davud paşanı Anadolu ordusu ilə onun köməyinə göndərdi. Əmirlər və əsgərlər türkman ordusu qarşısında səf çəkdilər. Bir-birilərinə həmlə etdilər. Hava ordunun tozanağından qaraldı və qorxudan gümüş üzlü ayın çöhrəsi zəfəran rənginə döndü (saraldı). Asimanın şahsü-

[1260] *Qurani-Kərim, “Ələq” surəsi, 6 və 7-ci ayələr.*
[1261] *Qurani-Kərim, “Nisa” surəsi, 57-ci ayə.*
[1262] Osmanlı sultanı II Məhəmməd Fatehin oğlu.
[1263] Rumiyyeyi-Suğra (Kiçik Rum) – Osmanlı dövləti tərkibində h. 816 / m. 1413-cü ildə yaradılmış vilayət. Amasya, Tokat və Sivas bölgələrini əhatə edirdi *(A.Açıkel. Rum eyaleti // TDVİA, cilt: 35, yıl: 2008, s.225-226).*

varı (Günəş) Nahidə (Venera) kimi şivən qoparmağa başladı, Zöhrə Bərcisin (Yupiterin) və Bəhramın (Marsın) qucağında cuşa gəldi, Keyvanın sinəsində ürək kinlə və qanla doldu, bahadırların qanından yer ləl [kimi qırmızı] geyindi.

Beyt

“Tozla doldu ayın üzü savaşdan,
Torpaqla doldu balığın ağzı tozanaqdan.
Yer gəmi kimi oldu qan dalğasından,
Gah düz hərəkət etdi, gah başı aşağı döndü.
Ordunun tozanağında döyüşçülərin xəncəri,
Zəncilərin gülüşü kimi parlamağa başladı”.

Çoxlu çalış-vuruşdan sonra türkman ordusu fərar yolunu tutdu. Yusif bəy bir sıra əmirlərlə birlikdə əsir alındı. İyirmi minlik qoşunun onda biri min cür çətinliklə canını salamat qurtardı. Davud paşa əsirləri Sultan Mustafanın hüzuruna gətirdi. O qəhr olmuş dəstənin içindən Yusif bəyi məşhur sərdarlarla birlikdə İstanbula göndərildi. Kinli bir şəkildə səfərə çıxmaq istəyən Sultan Məhəmməd dinin və dövlətin mənfəətinin zərurəti, məmləkət və millət əhlinin məsləhəti ilə [bu işi] təxirə saldı və həmin qışda hərbi hazırlıqlarla məşğul oldu.

Amma Həsən padşah qürurunun çoxluğuna, dövlətinin qüdrətinə, qolunun qüvvətinə, şücaətinə və igidliyinə bəslədiyi etimad üzündən Toqatın və çevrəsinin talan və qarət edilməsindən sonra sultanın məmləkətinə zərər verməyə və müdaxilə etməyə başladı. O, qaniçən ordusu ilə Şam diyarına yönəlib, Fərat çayından keçərək Malatya və Ayntab[1264] şəhərlərinə üz qoydu və qış mövsümündə Birə qalasını mühasirə etdi. Misir sultanı Qayıtbay qala əhlinə kömək etmək üçün Başbəy Dəvatdarı[1265] Misirdən, Məlikülüməranı Dəməşqdən və Hələbdən Həsən padşahla qarşıdurmaya göndərdi. Onlar qarşıda dayanıb, Fərat çayının aralıqdan axmasına baxmayaraq, top və tüfənglə türkman ordusundan bir çoxlarını həlak torpağı üzərinə saldılar. Suyun daşması və sellərin coşması səbəbindən Həsən padşah xoflu və vahiməli bir hala düşərək və Misir qoşununun müqavimətindən son dərəcə təsirlənib ruh düşkünlüyünə uğrayaraq Diyarbəkr tərəfə qayıtdı. Həsən padşahın əmirülümərası olan Əmir bəy Mosullu hərəkət bayrağını axirət tərəfə qaldırdı.

Həsən padşahın o diyardan dönməsindən sonra, baharın əvvəllərində asimandan gələn qəfil bir bəla kimi böyük bir sel türkman ordusunun içinə üz qoydu və bir çoxları ölüm girdabında qərq oldular.

### Xorasan diyarında baş vermiş hadisələr və Sultan Hüseyn mirzənin Sultan Mahmud mirzə ilə müharibə etməsi haqqında söhbət

Mirzə Yadigar Məhəmməd Xorasana yönəldiyi zaman Sultan Əbu-Səidin oğlu Sultan Mahmud mirzə Bəlxə gəldi. Sultan Hüseyn mirzənin tərəfindən həmin şəhərin hakimi olan Əmir Moğol və Sultan Əli Kickinə darvazanı möhkəmlətdilər. Sultan Mahmud mirzənin qoşunları müharibəyə və mühasirəyə başladılar. Bir neçə gün sonra Sultan Əli Kickinə, Əkaşə darvazasını şahzadənin üzünə açdı. Mirzə Sultan Mahmud Bəlxi fəth etməyə müyəssər oldu. O, Əmir Moğolu əsir aldı və inanılmış adamlarından olan Yadigar Ətəkə ilə Səmərqənd tərəfə yolladı. Yol əsnasında Yadigar Ətəkə, Əmir Moğolu dustaqlıqdan azad edib Sultan Hüseyn mirzənin dərgahına yola saldı. Nadir təsadüflərdəndir ki, Sultan Hüseyn mirzə məclisdə oturmuşdu və Əmir Moğolun qurtuluşu üçün fatihə oxuyurdu. Elə bu əsnada Əmir Moğol dərgaha gəlib çatdı.

Baharın əvvəllərində xəbər gəldi ki, Sultan Mahmud mirzənin adamlarından bir dəstəsi Mürğab çayı kənarına qədər basqın etmişlər və orada sakin olan Əmir Kərimdadı qətlə yetirmişlər[1266]. Ona görə də o həzrət (Sultan Hüseyn mirzə) Mürğab çayı kənarına hərəkət etdi. Pəncdeh (Beşkənd) mənzili sayı ulduzlar qədər olan ordunun məkanına çevrildikdə Qazı Əli, Həsən padşahın yanından gəlib, Azərbaycan padşahının məhəbbət nişanlı sözlərdən ibarət məktubunu gətirərək padşahın növbənöv lütflərinə layiq görülməklə şərəflən-

---

[1264] Ayntab (Antep) – Türkiyənin indiki Qaziantep şəhəri.

[1265] Dəvatdar – şahın şəxsi mürəkkəbqabısını və qələmini saxlayan, münşiül-məmaliklə birlikdə fərmanların və hökmlərin tərtibində iştirak edən saray məmuru. “Dəvatdari-ərqam” və “dəvatdari-ehkam” adlanan iki növ dəvatdarın olduğunu bilirik *(Mirza Səmia. Təzkirətül-müluk, s.26-27,57-58; V.F.Minorsky. “Tadhkirat al-Muluk”, p.133)*.

[1266] “Həbibüs-siyər”ə görə, “Kərimdadı əsir aldılar və Əmir Pir Məhəmməd Orlatı öldürdülər” *(Nəvai, şərhlər, s.758)*.

dirildi və geri dönmək üçün izin aldı. Ondan sonra qələbə əlamətli bayraqlar müxaliflərin üstünə hərəkətə gələrək Çəkmən[1267] mənzilində düşmənin qarşısında dayandı. Ertəsi gün o iki sərdar döyüş səfi qurdular. Sağda [Sultan Hüseyn mirzənin] böyük qardaşı Bayqara mirzə fəth ayəli bayrağını qaldırdı. Əmir Həsən Şeyx Temur cəsur süvarilərdən [ibarət] bir dəstə ilə o həzrətə kömək etməyi qarşısına məqsəd qoydu. O həzrətin sol cinahı Mirzə Sultan Əhmədin şövkətinin təntənəsi ilə möhkəmləndi. Şeyx Abdulla Abbasi, Əmir Əbdülxaliq Firuzşah və ordudan bir çoxları ehtiyatda qaldılar. Əmir Müzəffər Barlas, Əmir Əhməd Əli Farsi, Əmir Şeyx Əbu-Səid Candərmiyan, Əmir Moğol və Altun İşıq qaravul təyin edildilər. O tərəfdən Sultan Mahmud da ordusunun səfini tərtib etdi. O, öz qələbə şüarlı qoşununun sağ və sol cinahlarını iş bacaran ərlər və döyüş gününün igidləri ilə möhkəmləndirdi.

Nəzm

“Daha sonra nərildəyən sərxoş şirlər kimi,
Aldılar əllərinə parlaq qılınclarını.
Yekdil və dilbir olmuş güruh,
Qılıncdan və nizədən başqa mədəd axtarmadı.
Kin ahəngi ilə at çapdılar,
Bir anda düşmənlərə hücum etdilər.
Sipər oxu qanad vuraraq gəldi,
Əcəl canı tarac etmək üçün gəldi.
Ox iki tərəfdən xəbərsiz yetişdi,
Biri dəyməsə də, o biri dəydi.
Döyüş günündə atılan oxdan,
Qədd-qamətlilər soldan və sağdan,
Hər biri pəri (kabus) şəklinə döndülər,
Pəridə belə yox idi belə bir dilbərlik”.

O əsnada Qənbər Əli Əmiraxur cəsur cavanlardan [ibarət] bir dəstə ilə Əmir Həsən Şeyx Temura həmlə etdi. Əmir Həsən Şeyx Temur son dərəcə tədbirli olduğundan öz mülazimləri ilə qalxanlarını başlarına tutub yerlərindən hərəkət etmədilər. Sultan Hüseyn mirzə güman etdi ki, o, düşmənlərlə həmfikirdir. Sonra Əmir Məhəmməd Əli Ətəkəni və Əmir Dərviş Əli Kitabdarı beş yüz süvari ilə tulğama qoşunu[1268] kimi Həsən Şeyx Temurun tərəfinə göndərdi ki, əgər qaçmaq istəsə, ona mane olsunlar. Müxaliflər at çapıb ox atdıqda, Əmir Həsən Şeyx Temur cəsur atlılarla birlikdə qalxanlarını ataraq müxaliflərin üzərinə at çapdı və onları pərən-pərən saldı. O əsnada Sultan Əhməd mirzə, Əmir Şeyx Abdulla, Əmir Müzəffər Barlas və digərləri müxaliflərin sol cinahını məğlub etdilər.

Sultan Mahmud mirzə fərar yolunu tutdu. O əsnada Sultan Mahmud mirzənin ordusundan iki yüz süvari Mirzə Bayqaraya rast gəldi. Mirzə Bayqara onları dəf etməklə məşğul oldu. Qəflətən onun atı yıxıldı və o, yəhərin üstündən yerə düşdü. Müxaliflər onu əsir alıb yola düşdülər. Yol əsnasında qəflətən öz padşahlarının məğlubiyyəti xəbərini eşitdilər və Mirzə Bayqaranı atıb qaçdılar. Sultan Hüseyn mirzə düşmənlərin məğlubiyyətindən sonra Herat tərəfə qayıtdı.

### Müxtəlif əhvalatlar

Bu il Sultan Hüseyn mirzə, Əmir Əlişiri divan əmiri [təyin] edib, vəzir mənsəbini Xoca Nizamülmülk Xəvafiyə lütf etdi və Həsən Şeyx Temuru[1269] qətlə yetirdi.

[1267] Çəkmən – Əfqanıstanın şimal-qərbində, Əndxoydan şərq tərəfdə yer adı.

[1268] M.Öztürk (s.509) bu ifadəni “öncü birliyi” kimi izah etmişdir. Lakin qədim türk savaş taktikası olan “tulğama” ani hücumla cinahlardan dolanıb düşmən ordusunun arxasına keçməklə onu məğlubiyyətə uğratmağı nəzərdə tutan döyüş planı idi. Tulğama qoşunu isə düşmənin cinahlarına və arxasına qəfil zərbə endirə bilən çevik dəstələrdən təşkil olunurdu (bax: *Л.А.Бобров, А.В.Сальников. Тактический прием «тулгама» в военном искусстве монголов в XIII в. // Былые годы: российский исторический журнал, 2015, том 38, № 4, с.786-797*).

[1269] Həsən Şeyx Teymur – Sultan Hüseyn mirzənin dövlət adamlarından olub, Xəbuşan hakimi idi və xəyanət etdiyi üçün Herat yaxınlığındakı İxtiyarəddin qalasında həbs edilmişdi. O, həbsdən qaçmağa çalışdığı vaxt ələ keçirilmiş və öldürülmüşdür *(Nəvai, şərhlər, s.760).*

**877-Cİ İLDƏ (08.06.1472 – 28.05.1473) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT**

Toqat şəhərinin dağıdılması xəbəri Sultan Məhəmmədə çatdıqda dərgah əmirləri və saray adamları ilə məşvərət etdi. Onlar ərz etdilər ki, "mülk yumurtasının inad və nifaq əhlinin müxalifliyindən amansız qılınc sayəsində qorunması üçün hərb tədbiri görmək və qoşunun döyüş ləvazimatını tərtib etmək lazımdır". Ona görə də sultan qoşununu tərtib etməklə məşğul oldu.

Beyt

"Döyüş və savaş əndişəsinə qapıldı,
Rum və Firəng qoşununu tərtib etməyə başladı".

Ay kimi gəzən çavuşlar ordu toplanışı üçün diyarın ətrafına, yan-yörəsinə və bölgələrinə doğru hərəkətə gəldilər.

Şeir

"Daranın pənahı olan Cəmşidin fərmanı ilə,
Hər tərəfdən ordu hərəkətə gəldi.
Döyüş nizamındakı minik heyvanlarının nallarından,
Təzə ay gizləndi tozanaq altında.
Hər tərəfdən gəldi bir sərvər,
Hər birini bir qoşun müşayiət edirdi".

Moradan, Bosnadan, Əflaq sərhədindən, Alanyadan, Anadoludan, Məntəşa elindən, Qaramandan, Kastamonudan, Trabzondan və s. Rum bölgələrindən sonsuz ordu və bol qoşun sultanın dərgahına cəmləşdi ki, təfsilatı belə idi: iyirmi min əzəb, on min yeniçəri, on min qapı xalqı ("qapu xəlqi")[1270], altmış min digər qoşun. İstanbuldan [çıxaraq] cahangirlik əzmi ilə Rum dəryasından keçdi və Anadolunun dənizi görən, yaşıllıqla örtülmüş sahilinə adlayaraq İznik şəhərinə yola düşdü. Ulduz ədədli və qarışqa saylı qoşunun hamısının keçidi üçün İstanbul boğazı və oradakı gəmilər kifayət etmədiyindən, Rumeli əmirləri və qoşunları Gelibolu boğazından keçib Yengişəhərdə hökmdarın ordusuna qoşuldular.

Bəybazarı[1271] mövqeyində sultanın oğlu Sultan Mustafa Qaraman əmirləri və bol qoşunla atasının ordusuna birləşdi. Anadolu əmirləri və sərkərdələri, ordu sərdarları və saray xadimləri o güllü çəməndə zəfərə yaxın olan orduya qoşuldular. Qazabad səhrasında[1272] Sultan Bayəzid dəmir səddə bənzəyən bir ordu iləÜmman dənizinin dünya okeanına (dəryayi-mühit) birləşdiyi kimi [atasının ordusuna] birləşdi.

Sivas[1273] ovası asiman kimi [sonsuz] ordunun dayanacaq yeri olduqda [Sultan Məhəmməd] orduya baxış keçirilməsini əmr etdi. Ərzincan şəhəri cahan sultanının dayanacaq yeri olduqda, Həsən padşaha elçi göndərib onu öz hərəkətindən agah etdi. Həsən padşah cavab verdi ki, "biz də qantökən ordumuzla o diyara doğru yola çıxmışıq və sən yaxınlaşdığın zaman bir-birimizlə qarşı-qarşıya gələcəyik".

Beyt

"Ya murad ilə fələyin üzərinə ayaq qoyarıq,
Ya mərdliklə qeyrət uğrunda baş qoyarıq".

Sonra [Həsən padşah] Azərbaycan, İraq, Fars, İraqi-Ərəb, Ümman sahili, Kirman və Diyarbəkr qoşunlarını cəmləşdirib, can alan oxun ucu ilə Keyvanın başındakı papağı qaldıran və nizənin başı ilə civə rəngli asimanın başından günəşin zərli qübbəsini qoparan,

Şeir

"Hamısı dikbaş və boyun qıran,
Hamısı nizə vuran və qılınc oynadan,
Hərbin tədbirini gözəl bilən,
Savaşın yolunu yaxşı görən"

igidlərlə köçə-köçə yola düşdü.

---

[1270] Qapı xalqı və ya qapıqulu – Osmanlı sultanından məvacib alan hər növ nizami qoşun əsgərlərini bildirmək üçün istifadə edilən ümumi istilahdır *(Ф.А.Гусейн. Османо – сефевидская война 1578-1590 гг., с.194).*

[1271] Beypazarı – Ankara vilayətində, Ankara şəhərindən 100 km. qərbdə yerləşən ilçə mərkəzi.

[1272] Tokat yaxınlığındakı Qaz ovası nəzərdə tutulur.

[1273] Sivas – Türkiyədə, Qızılirmaq çayının yuxarı axarları yaxınlığında şəhər.

Nəzm

“Ordunun hərəkətindən yer yerindən oynadı,
Yerin tozundan asimanın başı gicəlləndi.
Təcrübəli mərd aslanların nəriltisindən,
Göylərin aslanı (günəş) əlsiz-ayaqsız oldu”.

[Həsən padşah] Ucan mövqeyində orduya baxış keçirilməsini buyurdu. Qırx min nəfərlik əzəmətli nizədar süvari və otuz min digər qoşun sayıldı. Amma öz əməlindən peşman idi. Lakin onun fəsadçı düşüncələrinin yaratdığı qarışıqlıqlar həddini aşmışdı. Onun səltənətinin ayparası[1274] sürəkli vərəm xəstələrinin ürəyi kimi çırpınmağa başlamış, onun dövlət bayrağının parçası xəzan görmüş yarpaq və qorxmuş adamların rüxsarı kimi sarılıq xəstəliyinə mübtəla olmuşdu. Buna baxmayaraq, o, Uğurlu Məhəmmədi on min nəfərlik yaxşı silahlanmış süvari ilə mənqəlay [təyin] etdi. Sultanın əsgərləri onun ordugahının yaxınlığına çatdıqda, buludu özünə pərdə edən günəş kimi Fərat çayına yaxın dağların keçidlərinə və təpələrin arasındakı dərələrə daxil oldu. Həmin böyük çay [iki ordunun] arasından axırdı.

O əsnada Rumeli əmirülümərası Xassə Murad qaravulluq etməyə çıxdı. Uğurlu Məhəmməd kinlə dolu türkmanlardan [ibarət] bir dəstə ilə pusquda idi. O, bəzən Rum əsgərlərinin yan-yörəsində öz bayraqlarını qaldırır, bəzən də özünü gizlədirdi. Xassə Murad sultanın yanına qasid göndərib yardım istədi. Sultan, Mahmud paşanı bəzi bahadırlarla ona köməyə göndərdi. Mahmud paşa müxaliflərin məkrini və hiyləsini anladıqda Xassə Muradı qarşıdurmadan çəkindirdi. Amma bəzi təcrübəsiz və hövsələsiz cavanlar və bir sıra ehtiyatsız və tədbirsiz igidlər Xassə Murada dedilər:

- Əlamətlərə və şahidlərə əsasən, Mahmud paşa türkman ordusunun məğlub olacağını müəyyənləşdirmişdir və murad çovqanı ilə müsabiqə topunu özü qapmaq istəyir. Dövlət üçün faydalı budur ki, biz daha öncə onlara hücum edək və onların qoşununu darmadağın edək.

Ona görə də Xassə Murad türkmanlara həmlə etdi. Uğurlu Məhəmməd də pusqudan çıxıb onu mühasirəyə aldı. Döyüş alovu alışdıqdan sonra Rum ordusu fərar yolunu tutdu. Türkmanlar Xassə Muradı dörd min nəfərlə birlikdə qətlə yetirdilər və Turxan bəyin oğlu Ömər bəyi bəzi böyük əmirlərlə birlikdə əsir aldılar.

Uğurlu Məhəmməd, Həsən padşahın yanına xeyirxah adamlar göndərdi və xəbər verdi ki, “elə bu gün aləmi yandıran qoşunlarla birlikdə qaçanların ardınca gedib Sultan Məhəmmədi də məğlub etməyimiz məsləhətdir”. Həsən padşah həmin gün rumilərlə vuruşmaq istəsə də, Sultan Xəlilin və digər övladların anası olan Səlcuqşah xanım ərz etdi ki, “Uğurlu Məhəmməd qoşun arasında tam etibar qazanmaqdan ötrü Rum ordusunun məğlubiyyətinin onun əli ilə baş verməsini istəyir”. Həsən padşah o kaftarın sözünü qəbul edib Uğurlu Məhəmmədi geri çağırdı. Bir neçə gün [döyüşü] təxirə saldıqdan sonra [Həsən padşah] məiyyət və ordu ilə ata minib savaş meydanına yönəldi. Hərçənd Sufi Xəlil Mosullu “vuruşmaq məsləhət deyildir və qeyblərin ən yaxşı bilicisindən (Allahdan) başqa heç kim vəziyyətin necə olacağını bilmir” deyə nəsihət versə də, Həsən padşah onun sözünə iltifat göstərməyib yola düşdü.

Xassə Muradın qətlindən sonra rumilərin ordusu bir-birinə dəymişdi.

Beyt

“Rum qoşununun ürəyi yerindən qopdu,
Atəş kürəsindəki şama bənzədi”.

Amma ali mənşəli sultan ixtiyarsız baş vermiş o hadisədən təsirləndi və heyrətləndi və xasların xası olan Xassə Muradın qətlindən çox kədərləndi. Buna baxmayaraq, Allah-taala o hadisəni, həqiqətən, fəthin və zəfərin başlanğıc yoluna çevirdi. Çünki Həsən padşahın köhnə lovğalıq və xudpəsəndlik düşüncələri yenidən baş qaldırdı və o, bu hadisəni digər sultanlarla baş vermiş hadisələrə bənzətdi. Belə ki, o, öz qələbəsinin xəbərlərini ətrafdakı və yan-yörədəki məmləkətlərə göndərdi. Amma bilmədi ki, zəmanənin və buqələmun çərxi-fələyin oyunbazı öz hoqqasında bu məsələyə dair əks oyunlar və tərs işlər gizlətmişdir. O isə bu qəbildən olan oyunları istehza və rişxənd qismindən sayardı. Amma sultan qızmış şir kimi intiqam məqamında dayanıb, qan içən qılıncını sıyıraraq Xassə Muradın vəhşətli əhvalatının və dəhşətli hadisəsinin baş verdiyi yerdən

[1274] Burada türk padşahlarının öz bayraqları və çətirləri üzərinə vurduqları ayparaya işarə edilmişdir *(Öztürk, şərhlər, s.512)*.

iki-üç mənzil irəli gəldi. Bədxah rəqibinin və yolsuz-yöndəmsiz düşməninin isə mücadilə və qarşıdurmaya tabı olmadığı üçün bir həftə ərzində döyüşdən çəkindi.

Nəhayət, çaharşənbə günü, sözügedən ilin[1275] rəbiüləvvəl [ayının] 16-da sultanın qoşununun sağında və solunda, dağlarında başlarında türkman qoşununun bir neçə səfi göründü. Xəbərçilər Sultan Məhəmmədə ərz etdilər ki, "Həsən padşah kinli ordu ilə dağda möhkəmlənərək vuruş və döyüş bayrağını qaldırmışdır; çox güman ki, dağ zirvəsindən məkr və hiylə ilə həmlə etmək və o dağlıq ərazidə vəhşi heyvan kimi şikar pusqusunda durub məqsəd ovunu ağzına almaq istəyindədir". Bu xəbər əlahəzrətin qulağına çatdıqda sultan fələk kimi yeriyən,

Şeir

"Murad kimi gedən və ruzi kimi çatan,
Yel kimi sıçrayan və atəş kimi ağız açan,
Enişə doğru Novruzdakı qətrə kimi tələsən,
Yoxuşa doğru Azardakı[1276] bulud kimi yüyürən,
Düşüncə kimi iri addımlı, tamah kimi uzaqgörən,
Yaxşılıq kimi təsirli, var-dövlət kimi uğur gətirən"

xallı atına minib, ordunun hazırlanmasını əmr etdi və özü dəmirə qərq olub mərkəzdə qərar tutdu.

Nəzm

"Nihandır zirehdə aslan hökmdar,
Parlaq günəş bulud arxasında gizləndiyi kimi.
Nərgiz kimi bir çox göz ona heyrandır,
İki yüz can hər guşədən ona qurbandır.
İkibaşlı ilana bənzər iti nizəsi,
Şəkər yerinə ucunda ilan zəhəri.
Parlaq günəş kimi baş qaldırmış,
Camalı nurlu aya tənə vurmuş".

O, öz ordusunun önündə araba və zəncirlə möhkəmləndirib olduqca mətin bir istehkam qurdu.

Beyt

"Elə ki şah qoşunun mərkəzinin zəhmətini çəkdi,
O yarıqda (aralıqda) İsgəndər səddi çəkdi".

Təxminən on min nəfər yeniçəri səfin qarşısında dayandı. Hər biri əlində tüfəng tutmuşdu və qısa süngüləri də vardı. Mərkəzə yaxın yerdə "sipahi oğlan"[1277] dedikləri min beş yüzə yaxın süvari, həmçinin "silahdar" adlanan iki min[1278] nəfər digərləri, iki minlik "əzəb igidi" cavanlar dəstəsi sağdan və soldan, eləcə də ülufəçilər[1279] camaatı soldan və sağdan [mövqe tutmuşdular]. Sultanın mərkəzində süvarilərin və piyadaların ümumi sayı iyirmi min idi. Onun oğlu Sultan Bayəzid və vəziri-əzəm Mahmud paşa böyük əmirlərdən, tuğ və ələm sahiblərindən qırx sancaqla sağ cinahda qərar tutdular. Piyada qoşun olan Rumeli əzəbləri camaatı yeniçəri qoşunlarının vəziyyətini alaraq Rumeli qoşununun önündə dayandılar. Sol tərəfdə Sultan Mustafa Qaraman ordusu və Davud paşa Anadolu qoşunları ilə, iyirmi dörd adlı-sanlı əmirlə durdu və iyirmi min əzəb Rumeli qaydasında qoşunların önündə səf bağladı. Səf yaran ordunun və şir yıxan piyadaların silahlarının, qılınclarının və nizələrinin çoxluğundan səhranın fəzası bostan və gülşən kimi oldu.

Şeir

[1275] Başlıqda h. 877-ci il yazılsa da, əslində bu döyüş h. 878-ci ildə baş vermişdir. Beləliklə, həmin tarix miladi təqvimlə 11 avqust 1473-cü ilə təsadüf edir.

[1276] Azar – Süryani təqvimdəki ayların altıncısıdır və baharın ilk ayıdır *(Öztürk, şərhlər, s.514).*

[1277] Sipahi oğlan bölüyü – Osmanlı ordusunun "qapıqulu süvariləri" adlanan növünün ən elitar hərbi birləşməsi idi və 300 bölükdən ibarət idi. Onların bayrağı qırmızı rəngdə idi. Silahdarlar bölüyü – "qapıqulu süvariləri" qoşununun ikinci ən mühüm hərbi birləşməsi idi və 260 bölükdən ibarət idi. Onların sarı bayrağı vardı. Hər iki qoşun əsilzadə ailələrin gənc oğlanlarından təşkil edilirdi *(Ю.Агаев, С.Ахмедов. Ак-коюнлу – османская война, 1472-1473 гг. Баку, 2006, с.67-68).*

[1278] Paris nüsxəsi: "on min".

[1279] Ülufə - "maaş" mənasındadır. Ülufəçilər – qapıqulu əsgərlərinə daxil olan hərbi birləşmələrdən sayılırdı. Sağ və sol ülufəçilər deyə 2 qrupa ayrılırdı. Sağ ülufəçilər 120, sol ülufəçilər isə 100 bölükdən ibarət idilər. Əsas etibarilə xristian ailələrin müsəlmanlaşdırılmış övladlarından təşkil olunurdu *(A.Özcan. Ulûfeciyân // TDVİA, cilt: 42, yıl: 2012, s.126-127).*

"Gülgün yüksəklikdən günəşin yaraşıqlı nizəsi,
Bayrağının kinli atəşini vurmuşdur asimana.
Gülgün qalxanlar o döyüş meydanında,
Görünürdü igidlərin gözünə laləzar kimi.
Yer yaşıllığa bürünmüşdü,
Bəzənmişdi növrəstə gözəllərin rüxsarı kimi.
Digər tərəfdən bərkə-boşa düşmüş düşmən,
Cövlan ahəngi ilə tərpəndi yerindən.
İranzəmin sultanları və xanları,
Soldan və sağdan səf çəkdilər".

Həsən padşah dağ əndamlı, külək rəftarlı,

Şeir

"Dağ əndamlı, ay yerişli və çərxi-fələk kimi qıvraq,
Yeri döyən, dənizə qalib gələn və yolu arxada qoyan,
Külək kimi çevik və bulud qədər hündür,
Ördək kimi üzən və bəbir kimi cəsur,
Xilqəti qılınc kimi, quyruğu düyünlü,
Dörd ayağı sürətlə diyirlənən bir dirhəm kimi"

atına minib, qorxmaz türkmanlardan və heyrətli türklərdən [ibarət] bir dəstə ilə mərkəzdə qərar tutdu. Səadətli sağ cinahda kiçik oğlu Zeynal bəy adlı-sanlı əmirlərdən Şahəli bəy Pornak, Bayandur bəy, Sufi Xəlil Mosullu və Süleyman Bicən səf yaran igidlərdən [ibarət] bir dəstə ilə qərarlaşdılar. Sol cinahda Murad bəy Cahangir oğlu, Əlixan bəy Cahangir oğlu, Qasım bəy Qaramanoğlu, Mənsur bəy Əfşar, Elaldı bəy Çepni və Aslan bəy Zülqədər cövşən geymiş bahadırlardan [ibarət] çoxsaylı bir dəstə ilə döyüş bayraqlarını qaldırdılar. Böyük oğlu Uğurlu Məhəmməd sol cinahda, izdihamlı qoşunun yanında ehtiyatkarlıq məqsədi ilə gözləyirdi. Ondan sonra güruh-güruh və dəstə-dəstə döyüş meydanına yönəldilər.

Şeir

"Qoşunlar bir-birinin ardınca dəstə-dəstə,
Gurlayaraq çatdılar sel kimi.
Hər iki tərəfdən fitnə çıxarıb gəldilər,
Qülzüm dənizi kimi cuşa gəldilər".

Türkman qoşunu sultanı dəf etmək və rumiləri qırıb-biçmək üçün atəş saçan qılınclarını qınlardan sıyırıb, fitnə nişanlı nizəni atların qulağı üzərindən irəli uzadaraq döyüş və savaş meydanında və dağların başında dövr edən asimandakı ulduzlar kimi səf çəkdilər.

Beyt

"Qoşunun hamısı şiddətdə və qüvvətdə erkək aslan kimi,
Ordunun hamısı sinədə və bazuda sağlam fil kimi".

Belə ki, döyüş meydanı adlı-sanlı cəngavər süvarilər və izdihamlı piyadalar üzündən məhşər çölünə döndü. Nizədarlar ucbatından səhranın səthi meşəyə çevrildi. Qan saçan mizrağın əksindən havanın üzü parlaq şimşəklərlə doldu. Kosun, gərənayın, sincin və zərli zəngin avazının heybətindən az qaldı ki, fələyin dairəsi hərəkətdən vaz keçib dayansın və yerin mərkəzi su kimi rəvan olsun.

Həsən padşah bir dağın başına çıxıb, o şövkətli qoşunla düzə və dağa hayqırış və qovğa saldı.

Beyt

"İgidlərin hay-huyu o mərhələdə,
Göyün doqquz qatına zəlzələ saldı".

Dəmbədəm tutqun bulud kimi dağ başında qılınc və nizə şimşəklərini nümayiş etdirirdilər.

Beyt

"Qalxanlar igidlərin çiynində şövkət ilə,
Dağdan görünən parlaq günəş kimi idilər".

Dağ başına ildırım kimi nərilti saldı. Amma öz yerindən bir addım belə irəli gəlmədi.

Nəzm

“Qələbə şüarlı sultan bildi ki,
Bəla gəlmiş sağdan və soldan.
Tərpəndi sel kimi o iti dağdan,
Lakin döyüşdə ayağını ehtiyatlı tutdu”.

Sonra sultan orduya [dağa] qalxmağı əmr etdi. Əvvəlcə Mahmud paşa qırmızı papaqlılar qoşunu, əzəblər və Anadolu süvariləri ilə türkmanların üzərinə yönəldi. Döyüş atəşini alovlandırdılar. Fəlakətlərin və bəlaların selini, ənənəvi qaydanın əksinə olaraq, aşağıdan yuxarıya doğru axıdaraq bir anda onlara top və tüfəng atdılar.

Beyt

“Tüfəngin qığılcımları uca göy üzünə qalxdı,
Çünki ordu ucbatından yer üzündə yer az idi”.

Nağaranın və dəli-dolu kosun sədası, şeypurun və tunc neyin avazı fələklər fələyinə çatdı.

Şeir

“Həftcuş[1280] küp sərxoşlar kimi gurlayır,
Onun cuşu başdan aparır huşu.
Elə bir küp ki, ürəyi əldən alır,
Bütün xalqı əlsiz-ayaqsız edir”.

Sağ cinahdan Sultan Bayəzid dağın zirvəsinə çıxıb Uğurlu Məhəmmədə həmlə etdi. Böyük bir döyüş baş verdi. Nizənin atəşinin tüstüsü Keyvan eyvanına çatdı və qan saçan qılıncın şöləsi asimana dil uzatdı. İgidlər oxun ucu ilə düşmənin gözünün çeşməsindən su çıxarırdılar. Bahadırlar xəncərin neştəri ilə can damarını açırdılar. Ciyər deşən ox dərzi kimi dəbilqəni cəngavərlərin başına tikir, iynənin ipəkdən və qumaşdan keçdiyi kimi dəbilqədən və xəftandan[1281] keçirdi. Tüfəng şimşək və ildırım kimi parlaq cövşəni deşib keçirdi.

Nəzm

“O döyüşdə tüfəng mərmiləri,
Zireh gözlərinin arxasında göz bəbəyi oldu.
Başlarına qılınc dəyən igidlər,
Başında şimşək çaxan dağ kimi idilər.
Oxun adamın başından axıtdığı qandan,
Bu lacivərd günbəzə (göy qübbəsinə) şəfəq doğdu.
Döyüşçülərin qafa tasının qanından,
Qədəhlər lalə rəngli badə ilə doldu”.

Soldan Sultan Mustafa və Davud paşa Qaraman qoşunu ilə Həsən padşahın yerləşdiyi dağın başına cumdular.

Beyt

“Cumdular bir dəstə Rum igidləri,
Şamı tarac edən atəş şöləleri kimi”.

Anadolu ordusu və əzəb piyadaları qəzəblə həmlə etdilər və mərkəzi top-tüfəng zərbəsi ilə devirdilər. Belə ki, tuğun və ələmlərin başı tüfəng zərbəsindən deşik-deşik oldu.

Şeir

“Tüfəng şimşəyindən ələmin başı əzaba düşdü,
İstidən və həratətdən manqal közü kimi oldu.
Ox sürətli və tez bir şəkildə yolu adladı,
Bəla tələsindən qaçan quşlar kimi”.

---

[1280] Həftcuş – 7 metalın (dəmir, qalay, qurğuşun, qızıl, sink, mis və gümüş) qarışığından ibarət olan mürəkkəb filizdir. Kos adlanan iri döyüş təbillərinin düzəldilməsində istifadə olunurdu *(N.Musalı. I Şah İsmayılın hakimiyyəti, s.346).*

[1281] Xəftan – döyüş zamanı zirehin altından geyilən libas.

Hələ sultan dağın başına və hiyləgər ordunun məkanına çatmamışdı ki, Mahmud ağanın başçılıq etdiyi Anadolu əzəbləri Həsən padşahın oğlu Zeynal bəyin ordusuna çatıb həmlə etdilər. Zeynal bəy qızmış şir və coşmuş bəbir kimi bir dəstə türkmanla əjdahaya bənzər nizələrini külək kimi sürətli atlarının qulaqları üzərindən irəli uzadıb onlara çevik həmlə etdilər.

Şeir

Sınıq ürəklilərə böyürdən yaxınlaşdı,
Nizələr ürəyi deşən iynələr oldu.
Yaxalar həddən artıq qanla doldu,
İgidlərin boynu öz qanlarına bələndi".

Sonra neçə-neçə adam və at yerə yıxıldı. Öküzün[1282] beli onların yükünün ağırlığından əyildi və yerin mərkəzi onların qanından nəm çəkdi. İki tərəfdən öldürülənlərin cəsədlərindən və əzalarından keçiş yolu daraldı. Amma bunun bir faydası olmadı. [Zeynal bəy] piyadaların arasına soxulsa da, Mahmud ağa onun atını təqib etdi və Zeynal bəy yəhərin üstündən yerə yıxıldı. Mahmud ağa onun başını bədənindən ayırıb Sultan Mustafanın qarşısında yerə qoydu. Şahzadə onun başını ordunun mərkəzinə, atasının yanına göndərdi[1283].

Həsən padşahın cinahında yerləşən Zeynal bəyin qətlindən sonra o həzrətin qolu-qanadı qırıldı. O əsnada Anadolu ordusu və əzəblər qoşunu özünü Həsən padşahın tuğunun ayağına çatdırdı. Onun dik duran bayrağının pərçimi ay üzlü gözəllərin telləri kimi pərişan və dağınıq oldu. Hələ sultanın qoşunları Həsən padşahın [ordusunun] mərkəzi ilə toqquşmamış, onun əksər böyük əmirlərini həlak torpağı üzərinə sərdilər. Hər tərəfdən o şövkətli güruh Həsən padşahın üzərinə həmlə etdi və onun bayrağını yerə saldılar.

Nəzm

"Düşdü göydən tuğlar kədərlə dolu,
Bayrağın günəşi zavala yetdi.
Gəmi kimi fələk qan dənizində qərq oldu,
Yelkənindəki bayraq başı aşağı düşdü".

O həzrət yəqin bildi ki, bir an belə artıq dayanarsa, əsir alınacaqdır. O, bütün xidmətçilərini və əsgərlərini ataraq tək süvari kimi çarəsizcə döyüş meydanını tərk etdi. Həsən padşaha tam oxşayan Pir Məhəmməd bəy Alpavut yerində dayandı və rumilər onu tutdular. Dedi ki, "mən Həsən padşaham". Həsən padşahın bayrağını yıxan və Həsən padşahın oxşarı Pir Məhəmməd Alpavutu əsir alan bir dəstə Rum əsgəri böyük əmirlərlə birlikdə zəncirlərlə və qandallarla məhbus edilmiş türkman sərkərdəsini başı aşağı dönmüş bayraqları ilə birlikdə sağ cinahdakı Sultan Bayəzidin hüzuruna gətirdilər. Hələ Uğurlu Məhəmməd onların qarşısında dayanmışdı ki, atasının bayrağını gördü. Onun da daha artıq müqavimətə taqəti qalmadı və qaçış yolunu tutdu. Sultan Bayəzidin ordusu onları təqib edib bir çoxlarını qətlə yetirdi.

Şeir

"Birisi gürzlə yıxıldı, digər biri oxla yıxıldı,
Torpağa sərildilər, yerlə yeksan və əsir oldular.
Bütün qılınclar qırmızı qana qərq oldu,
Su dəryasından atəş töküldü.
O şur və şər meydanında o qədər qan axdı ki,
Yer qırmızı yumurta kimi gəldi nəzərə".

Həsən padşah murad atının rəzillərin üzrü kimi ləng və cahan ərazisinin paxılların hövsələsi qədər ona təng olduğu əyyamın ala atının uğursuz hərəkəti səbəbindən döyüş yerindən arvad-uşaqların olduğu ordugaha kimi üç günlük yolu bir gündə qət etdi və müvəqqəti həyat libasını o təhlükədən çıxara bildi. Sultan dustaqlardan, xüsusən Pir Məhəmməd Alpavutdan Həsən padşahın varlığını və ya yoxluğunu soruşdu və

[1282] Burada qədim təsəvvürlərə əsasən, guya yeri öz üzərində saxlayan öküz nəzərdə tutulmuşdur.

[1283] Mahmud ağanın Zeynal bəyi öldürməsi Paris nüsxəsində bu cür təsvir edilmişdir: "[Zeynal bəy və döyüşçüləri] hər nə qədər sultanın dövlət çırağını söndürmək üçün özlərini pərvanə kimi Mustafanın rəhbərlik şamına daha çox vursalar da, onların iqbalının qolu-qanadı haqq əhlinin zəfər məşəlinin təsirindən bir o qədər çox yanırdı. Şahzadə Mustafanın piyadaları çeviklik nümayiş etdirib, Zeynal bəyin atının əlini-ayağını kəsərək yerə yıxdılar. Güllə yarası alaraq qanadı qırılmış quşun yuvasından düşdüyü şəkildə Zeynal bəy yerə yıxıldı. Əcəl ovçusu Mahmud ağanın qılıncının köməyi ilə onun başını bədənindən ayırıb Sultan Mustafaya göndərdi və şahzadə onu atası Sultan Məhəmmədin yanına yolladı".

onun fərar etdiyini eşitdi. Sultan aşkar fəthdən və təmkinsiz düşmən üzərində qazandığı qələbədən sonra zəfər dolu həmin yerdə və məkanda qoşunun vəziyyətini təhqiq etmək və cəmi türkmanların cəzalandırılmasını hökm etmək üçün aqibət çadırlarını dövr edən asimana yüksəltdi.

Rumilər Həsən padşahın ordusunu qarət edib, Xassə Muradla[1284] döyüşdə əsir düşmüş Turxan bəyin oğlu Ömər bəyi xilas etdilər. Bu vuruşmada Mirzə Seyid Əhməd ibn Mirzə Miranşah ibn Sahibqiran Əmir Teymur Kürəkanın övladları olan Mirzə Məhəmməd Bağır, Mirzə Zeynal və Mirzə Müzəffər əsir alındılar və sultanın əmri ilə Amasya qalasında məhbus edildilər.

Sultan döyüş meydanında yerbəyer olub dərgah əmirləri və ordu başçıları ilə Həsən padşahın təqib edilməsi barəsində məşvərət etdi. Əksər əmirlər təqib etməyi məsləhət gördülər. Amma öz ağlına, fərasətinə, fəhminə və uzaqgörənliyinə görə bütün əmirlərdən və dövlət ərkanından tamamilə üstün olan Mahmud paşa sultanı Əcəm diyarına getməkdən daşındırdı. Ondan sonra sultan, Pir Məhəmməd Alpavut və Bayəzid bəy Cagirlünün oğlu Ömər bəy kimi Qara Yusifə tabe olmuş Qaraqoyunlu əmirlərinin hamısını azad etdi və önəmsiz adamları öz halında buraxdı. Təbbaxlar (aşpazlar) və fərraşlar kimi bəzi xidmətçiləri layiqli xidmətlərə təyin etdi. Amma fazillərə və alimlərə böyük hörmət göstərdi. O cümlədən Qazı Mahmud Şərihi, Həsən padşahın münşilik[1285] mənsəbini daşıyan Xoca Seyid Məhəmməd Münşi və Həsən padşahın imamlıq və müsahibət mənsəbini daşıyan, şəriət elmlərində, xüsusən hədis və qiraətdə ("Quran" oxumaqda) məharətə malik olan Qazı Əli Həsənkeyfi yüksək şanlı sultanın nəzərləri qarşısına çıxıb ali mənsəblərə ucaldıldılar. Sultan bu qələbəyə görə şükür etməkdən ötrü təxminən qırx min qulam azad etdi və hər xərvarı yüz min Rum axçası olan yüz xərvar gümüşü əmirlərə və əsgərlərə ənam verdi. Sultanın gözləri qarşısında Ağqoyunlu tayfasının hamısının (yəni Ağqoyunlu əsirlərinin hamısının) tək-tək boynunu vurdular. Belə ki, bir gündə təxminən üç min nəfər qətlə yetirildi. Zəfər nişanlı sultan üç gün o döyüş meydanında oturub ondan sonra geri döndü və fərman verdi ki, hər mənzil başında Ağqoyunlu camaatından dörd yüz nəfərin boynunu vursunlar və onları bir-bir yolun üstünə atsınlar. Fazillərdən biri o tarix haqqında yazmışdır:

Tarix

"Mustafanın dininin köməyi Sultan Məhəmməd ibn Murad,
Çəkdi haqqın qılıncını qəvi düşmənə qarşı.
Qeybdən, qəlb dilindən söylənildi bu tarix:
Qalib olsun daima Allahın köməyi və qüvvətli hökmü ilə"[1286].

Rumi türkcəsindəki tarix əsərində məşhurdur ki, Həsən padşah çaharşənbə gününü özü üçün mübarək bilirdi. Çünki Cahanşah padşah və Sultan Əbu-Səid həmin gün ələ keçirilmişdi. Bu dəfə də çaharşənbə günündə döyüşməsinə baxmayaraq, məğlub oldu.

Sonra sultan köçə-köçə İstanbula yola düşdü. Qarahisarın ətrafı saysız ordunun dayanacaq yeri olduqda o qalanın hakimi Darab bəy Pornak qalaya sığındı. Rum əsgərləri qalanı mərkəz kimi dövrəyə aldılar. Darab bəy rumilərin qorxusundan qalanı təslim etdi. Sultan oradan İstanbula yönəldi.

Rum padşahının geri dönüşündən sonra Həsən padşah Azərbaycan taxtgahında cah-calalla əyləşərək iqtidar bayrağını ucaltdı.

**Ölümlər**

Bu il Şeyx İbrahimin oğlu Sultan Xəlil kədər məkanından əbədiyyət aləminə köçdü. Səltənətinin müddəti qırx yeddi il olmuşdur. Məmləkəti Şirvan diyarı idi. Fərrux Yəsar [adı] ilə məşhur olan oğlu Şirvanşah onun yerinə keçdi[1287].

---

[1284] Xassə Murad əslən Bizans imperatorlarının Paleoloq sülaləsindən idi. O, Osmanlı dövlətində paşa titulu əldə etmiş və vəzirlik məqamına qədər yüksəlmişdi *(Nəvai, şərhlər, s.771-772)*.
[1285] Münşi – katib, sarayda yazı işləri ilə məşğul olan məmur. Münşilərin başçısı "münşiül-məmalik" adlanırdı.
[1286] Ərəbcə yazılmış bu maddeyi-tarix əbcəd hesabı ilə 878-ci ilə bərabərdir.
[1287] Əslində bu hadisə 869 / 1465-ci ildə baş vermişdir *(S.Aşurbəyli. Şirvanşahlar dövləti, s.311)*.

## 878-Cİ İLDƏ (29.05.1473 – 17.05.1474) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Sultan Məhəmmədin Qaramanoğulları üzərinə qoşun çəkməsi

Pir Əhməd bəy Qaramanoğlu Tərcan döyüşündən xilas olduqdan sonra Qaraman diyarında qardaşı Məlik Qasıma birləşdi və onlar Silifke qalasında möhkəmləndilər. Oradan istila bayrağını qaldırıb, Larəndə şəhərinə basqın etdilər. Ona görə də Sultan Məhəmməd, Gədük Əhməd Paşanı Anadolu qoşunları ilə Qaramanoğlunu qırıb-biçməyə göndərdi. Əhməd paşa hərəkət bayrağını Konyaya doğru qaldırdı və adı çəkilən şəhərin ətrafında atası [Sultan Məhəmməd] tərəfdən oranın valisi olan Sultan Mustafaya qoşuldu.

Sonra o iki xoşbəxt bir-biri ilə ittifaq halında, əcəl kimi iş bitirən çoxlu qoşunla o bəxti dönmüşlərin üzərinə sürətli yürüş etdilər. Yürüşdən öncə əhd-peyman bağlamaqdan ötrü Qaramanoğlunun yanına iş bacaran elçilər göndərdilər. Pir Əhməd bəy elçilərə qonaqpərvərlik göstərmək niyyətində ikən Əhməd paşa çoxlu ordu ilə gözlənilməz bəla kimi o dövlətsizlərin üzərinə həmlə etdi. Pir Əhməd bəy böyük məşəqqətlə özünü sərt meşələrə və ağacla dolu dağlara saldı. Sultanın qoşunları onların bütün mallarını qarət edib bir çoxlarını əsir aldılar və çoxlu mallarla, saysız qənimətlərlə Larəndə şəhərinə tərəf dönüb, yenidən qorxmaz igidlər və qantökən bahadırlarla Ərmənək qalasını[1288] fəth etməyə yönəldilər. O qalanın əhalisi izdihamlı qoşunların qorxusundan qalanı təslim etdi. Əhməd paşa Minan qalasına[1289] yönəldi. Oranı mühasirə etdikdən sonra topçular dedilər ki, "burada qazğan yerləşdirmək və top atmaq müyəssər olmadığı üçün bu qalanı topla tutmaq olmaz". O müdrik paşa bu sözə iltifat göstərməyib mühəndis tədbirləri ilə topları qalaya tuşladı.

Təsadüfən, sözügedən qalanın qarşısında son dərəcə uca bir dağ vardı ki, qaladan hündür idi və heç vəchlə sultanın əsgərləri o dağın başına çıxa bilmirdilər. Hər gün Pir Əhməd bəy qalanın vəziyyətini götür-qoy etməkdən ötrü dağın üstünə çıxırdı və qalanı seyr edirdi. Top mərmiləri bəzi bürcləri dağıtsa da, əsgərlər qalanı tuta bilmirdilər. Əhməd paşa elçilər göndərib qala əhlinə bunları bildirdi:

"Qala son dərəcə möhkəm olsa da, sultanın dövlətinin uğuru ilə onu tutmaq bizim üçün yetərincə asandır.

Şeir

"Biz indi bağlı qapıya əl atmırıq,
Əgər qapını bağlasan, bacadan yol var.
Əgər evin qapısını günəşin üzünə bağlasan,
O, sənin pərdəsiz pəncərəndən içəri girər".

İndi din sultanı ilə qohumluq əlaqəsinə malik olan Qaraman sülaləsinin arvad-uşağının şərəfini və namusunu hifz etməyə və qorumağa riayət edirik. Görüləsi ilk iş budur ki, qalanı təslim edəsiniz və qiyamət əlamətli əsgərlərin təcavüzündən əmin-amanlıqda olub, illərlə könlünüz rahat şəkildə o həzrətin bayraqlarının kölgəsində vaxtınızı keçirəsiniz".

Qala mühafizlərinə sultanın qorxusu təsir etdiyindən dərhal qalanı təslim etdilər. Əhməd paşa bəzi üzvləri sultanın quhum-əqrəbası olan Qaraman sülaləsinin mallarını, sərvətlərini, arvadlarını və ailələrini mühafizə edib, onlara qayğı göstərərək izzətlə və ikramla sultanın hüzuruna yola saldı və sultanın bayraqlarını qalanın başına sancdı.

Təsadüfən, Pir Əhməd bəy hər gün ənənəvi qaydada dağın başına çıxırdı və qalanı nəzərdən keçirirdi. Ertəsi gün o, qalanın düşmən əlinə keçdiyini və öz arvad-uşağının aparıldığını müşahidə etdikdə, çoxlu qəm-qüssə üzündən sinəsini cırıb, özünü həlak etmək qəsdi ilə dağ başından uçuruma atdı. Təsadüfən bir neçə ağac budağı onun paltarına ilişdi və o, dağla yamac arasında asılı qaldı. Mülazimləri çoxlu məşəqqətə qatlaşaraq ip və kəndirlə onu yuxarıya çəkdilər və nəsihətlə, təskinliklə onun könlünü almağa çalışdılar.

Əhməd paşa sözügedən qalanı zəbt etdikdən sonra hərəkət bayrağını Silifke qalasına doğru qaldırdı. Ora möhkəmliyi ilə vəsflənmiş, mətanəti və qorunaqlığı ilə məşhurlaşmış bir qala idi. Səba küləyi onun Fər-

[1288] Türkiyənin Karaman vilayətinin Ermenek ilçəsindədir.
[1289] Minan (Mennan) qalası – Ermenek ilçəsinin Görmeli kəndi ərazisindədir.

qədan ulduzları kimi [yüksək] küngürəsinə yetişməzdi və Qülzümün əli onun okean kimi [dərin] xəndəyinə çatmazdı.

Şeir

“İki yüz Qülzüm [dənizi] onun xəndəyindən yarı nəmli,
Ölüm okeanı və yoxluq dənizi idi.
Elə bir xəndək ki, hər dalğası düşməni qapan,
Heybət saçan köhnə bir əjdaha kimi idi”.

Həsən padşahın məğlubiyyəti günlərində Qasım bəy Qaramanoğlu o qalanı hiylə ilə ələ keçirmişdi və sultanın qulamlarını oradan çıxarıb, bəzi topçuları yanında saxlamışdı. Paşa o qalanın ətəyinə çatdıqda müharibə və mühasirə alətlərinin tərtib olunmasını əmr etdi və topçulara gizlicə belə bir xəbər göndərdi: “Siz sultanın bəndələrindən və o dərgahın dostlarındansınız. Zorən və məcburən orada giriftar olub qalmışsınız. Dövlət üçün faydalı budur ki, qalanı təslim edib ali mənsəblərə ucalasınız”. Bu səbəbdən onlar qəflətən barıt anbarına od vurdular və qala bürclərini dağıtdılar. Əsgərlər bir anda hücum edib qalaya daxil oldular. Əhməd paşa Qaramanın mötəbər adamlarından yüz səksən nəfəri qətlə yetirdikdən sonra Pir Əhmədin üzərinə yönəldi. Pir Əhməd müqavimət göstərməyə tab gətirməyib yüz əfsusla özünü Daşeli vilayətindən Tarsusa saldı və Sultan Qayıtbaya pənah apardı.

Bu əsnada Sultan Mustafa da Dəli Qarahisar[1290] qalasına yönəldi. Qala əhli Qaraman sülaləsinin bəxt ulduzunun səadət məşriqindən qürub və zaval enişinə meyil etdiyini və heç tərəfdən qalanı saxlamaq üçün ümidin olmadığını bildikləri üçün döyüşsüz və savaşsız qalanı ali mənşəli şahzadəyə təslim etdi. Sultan Mustafa ondan sonra Konyaya döndü.

**Uğurlu Məhəmmədin Həsən padşaha müxaliflik etməsi və onun Ruma getməsi haqqında**

Bu il Uğurlu Məhəmməd hərəkət bayrağını Bağdada doğru qaldırdı. Həsən padşahın oğlu Maqsud bəy, Danə Xəlillə birlikdə bahalı peşkəşlər götürüb Qəsri-Şirinə qədər onu qarşılamağa gəldilər və atasından sonra onu padşah edəcəklərinə dair söz verdilər. Uğurlu Məhəmməd onlarla birlikdə Həmədandan keçib İsfahana yollandı. O diyarın rəiyyəti əlacsızlıqdan onu qarşılamağa gəldi. Yüksək məqamlı şahzadə çatar-çatmaz bədxah adamların sözü ilə İsfahanın böyüklərini tutub şəhərə daxil oldu və onlardan min tümən aldı.

Bu xəbər alinəsəb padşaha çatdıqda hiddət və qəzəb üzündən böyük bir ordu ilə İraqa yönəldi.

Nəzm

“Bədxah onun işindən agah oldu,
Bildi ki, onun üçün qiyamət günü gəlmişdir.
Şir yıxan igidlərin nərəsindən,
Qaçar oldu meşədən o qızğın şir”.

Düşməni məhv edən bahadırların qorxusundan [Uğurlu Məhəmməd] özünü Şiraza yetirdi və oranın böyüyündən-kiçiyindən çoxlu qızıl topladı. Həsən padşah, Sultan Xəlili ağ tuğla və hamısı fil yıxan, şir ovlayan [əsgərlərdən ibarət] çoxlu qoşunla onu dəf etməyə yolladı. Uğurlu Məhəmməd Türkman tamamən kədər içində Şulistanın yolunu tutdu, qaçarkən səba küləyi kimi yer üzünü qət etdi və atəş kimi yandırıcı, külək kimi qıvraq qılıncın qorxusundan sanki yerin dibinə girdi. Sultan Xəlil Kuhi-Giluyəyə[1291] qədər onu təqib etsə də, tozuna belə çata bilməyib geri döndü.

Həsən padşah, Maqsud bəyi çağırıb, onu həbs edərək Sultan Xəlilə tapşırdı. Padşahın qorxusundan Müşəşə vilayətinə[1292] qaçmış Danə Xəlil əhd-peyman bağladıqdan sonra dərgaha gəldi. Həsən padşah Bağdad vilayətini ona verdi.

Uğurlu Məhəmməd köçə-köçə Bağdada gəlib oradan Ruma yönəldi. Sultan onu atalıq iltifatı və hökmdarlıq rəğbəti ilə bütün tay-tuşlarından seçkin və üstün qıldı və xoş söhbət məclisində ərəb və əcəm padşahlarının vəziyyətini ondan soruşdu. Uğurlu Məhəmməd onun cavabında gözəl sözlər və xoşagələn kəlmələr bəyan edib dedi ki, “İranzəmin padşahları öz mənzillərini şəhərin xaricində, könül oxşayan yerlərdə və

[1290] M.Öztürkə görə: Qarahisari-Dəvəlü *(Ahsenü't-Tevârîh, s.524)*.
[1291] Kuhi-Giluyə – İranın Fars vilayətinin şimal-qərb tərəfi belə adlanırdı.
[1292] İranın Xuzistan vilayəti nəzərdə tutulur. Həmin zaman bu vilayət Müşəşə xanədanının hakimiyyəti altında idi.

böyüyün-kiçiyin onları narahat edə bilməyəcəyi guşələrdə qururlar”. Sultanın hüzurunda söylədiyi bu cür müdrik kəlmələr bəyənildiyi üçün sultan mənzilini dəyişdi. İndi Rum sultanlarının qaldığı evlər həmin evlərdir.

**Xorasan diyarında baş vermiş hadisələr**

Yadigar Məhəmməd mirzənin istilası ucbatından Məhəmməd Ömər ibn Mirzə Sultan Xəlil ibn Mirzə Məhəmməd Cahangir ibn Mirzə Məhəmməd sultan ibn Mirzə Məhəmməd Cahangir ibn Sahibqiran Əmir Teymur Kürəkan, Sultan Hüseyn mirzənin ordusundan fərar edib Qəndəhara yollandığı zaman Sultan Əbu-Səidin böyük əmirlərindən olan Əmir Əhməd ibn Təvəkkül Barlas şahzadəni şəhərə gətirib onun mülaziminə çevrildi.

Mirzə Məhəmməd Ömər Qəndəharı zəbt etdikdən sonra çoxlu ordu ilə Quhistana yönəldi və Qain qalasını mühasirəyə aldı. Ona görə də Sultan Hüseyn mirzə müxaliflərin üzərinə hərəkətə gəldi. Zəfər nişanlı əsgərlərin qaravulları müxaliflərdən doqquz nəfəri tutub xilafət əlamətli taxtın ətəyinə gətirdilər. Onlar ərz etdilər ki, şahzadə Qaini ələ keçirməklə məşğuldur. Ona görə də o həzrət dörd min nəfər yaxşı silahlanmış süvari ilə onun üzərinə sürətli yürüş etdi. Mirzə Məhəmməd Ömər, Sultan Hüseyn mirzənin gəlişindən agah olduqda Qəndəhara yönəldi. O diyara çatdıqdan sonra Əmir Əhməd ibn Təvəkül Barlasın oğlunun törətdiyi kiçik bir xəta üzündən onun qətlinə fərman verdi. Eyni zamanda şikar əzmi ilə şəhərdən çıxdı. Böyük oğlunun öldürülməsi üzündən şahzadədən incimiş Əmir Əhməd Qəndəhar qalasının bürclərini və divarlarını möhkəmləndirib müxaliflik göstərdi və Sultan Hüseyn mirzənin dərgahına bir qasid göndərərək itaətini bildirdi. Mirzə Məhəmməd Ömər heyrət çölündə sərgərdan qaldı və xas adamlarından [ibarət] bir zümrə və bir az qoşunla Fərah qəsəbəsinə tərəf tələsdi. Sultan Hüseyn mirzənin şüurunun şəfəqi bu işlərin üzərinə düşdükdə, Əmir Müzəffər Barlası zəfər qazanan əmirlərlə o tərəfə göndərdi. İki tərəf arasında döyüş baş verdi. Vuruşma əsnasında şahzadənin alnına bir ox dəydi və o, əbədiyyət aləminə yollandı. Qəndəhar məmləkəti Sultan Hüseyn mirzənin hakimiyyəti altına keçdi.

**Ölümlər**

Pir Əhməd bəy ibn İbrahim bəy ibn Məhəmməd bəy Qaramanoğlu bu il ağır bir xəstəliyə tutuldu. Xəstəlik əsnasında yanında təbib olmadı. Qoca dünya kimi amansız olan, əyyamın keçməsi ilə qəddi kaman kimi əyilmiş və ömründən təqribən doxsan il keçmiş nadan bir qoca qadın və abırsız bir qoca qarı,

Nəzm

“Qəddi qozbellikdə kaman kimi əyri,
Böyrü və çiyni atın sağrı dərisi kimi sərt,
İki yanağı hind qozu kimi qırış-qırış,
Acıxiyar kimi hər biri şüşədə zəhər”,

ona acıxiyardan (əbucəhl qarpızından) şərbət verdi. Bunun nəticəsində o, qanlı ishal keçirib əbədiyyət aləminə köçdü.

Həmçinin bu il Sultan Məhəmmədin oğlu Sultan Mustafanın şərəfli səhhəti daim şərab içmək səbəbindən tamamən pozuldu, bəlalar ordusu və kədərlər qoşunu onun bədəninin ölkəsinə basqın etdi, xəstəliklər qoşununun tüğyanı səbəbindən ölüm yollarına düşdü və qeysərlik səltənətinin taxtını bir-iki qurtum şərab ucbatından bada verdi. Bundan öncə qulunc xəstəliyinə tutulmuşdu. Axırda qanlı ishal keçirdi. Atasının onu müalicə etmək üçün göndərdiyi peşəkar təbib onun köməyinə çata bilmədi. Ruhunun şahbazı bu səbatsız bədən qəfəsinin darısqallığından pərvaz etdi. Cəsədini Bursa şəhərində, babası Sultan Muradın yanında torpağa tapşırdılar. Şahzadə öz atasının tərəfindən Qaraman valisi idi. Onun vəfatından sonra Sultan Məhəmməd Qaraman vilayətini digər oğlu Cəm sultana verdi.

Həmçinin bu il vəziri-əzəm Mahmud paşa öz əməllərinin cəzasına çatdı. Sultanın siyasət (cəza) əli o pəhləvanlıq meşəsi aslanının həyat gündəliyini bağlayıb onu qətlə yetirdi.

Bu hadisənin təfsilatı belədir ki, Sultan Məhəmməd, Həsən padşahı məğlub etdiyi zaman onun ardınca gedib onu tamamilə ortadan qaldırmaq istədi. Lakin Mahmud paşa mane oldu. Ondan sonra bəlli oldu ki,

əgər sultan o vaxt Həsən padşahın ardınca getsəydi, onları tamamilə qırıb-biçərdi. Ona görə də sultan onu vəzirlik mənsəbindən çıxardı.

Sultan Mustafa dünyadan köçən zaman əmirlərin və dövlət ərkanının çoxu sultana başsağlığı verməyə gəldilər. Mahmud paşa da onlarla birlikdə gəlmişdi. Sultan Mustafa ilə Mahmud paşa arasında böyük bir kin-küdurət olduğu üçün düşmənlər sultanın qulağına çatdırdılar ki, "şahzadənin ölümünə görə Mahmud paşa o qədər sevinib ki, şadmanlıq günlərinin paltarlarını geyinir və əyləncə ilə məşğul olur". Ona görə də sultan casuslarını Mahmud paşanın xəlvətinə göndərdi. İş elə gətirdi ki, Mahmud paşa matəm libasını çıxarıb şahmat oynamağa başladı. Həmin şəxs məclisdən xaric olduqdan sonra vəziyyəti gördüyü kimi sultanın qulağına çatdırdı. Ona görə də sultanın qəzəb atəşi alovlandı, onu tutub İstanbul qalasında məhbus etdi və bir neçə gün sonra qətlə yetirdi.

Adı çəkilən paşa olduqca xeyirxah və səxavətli idi. Onun adına deyilən hər qəsidəyə mükafat olaraq beş min Rum axçası verirdi. İstanbulda bir cümə məscidi və mədrəsə tikdirmiş, oraya çoxlu əmlak vəqf etmişdi.

## 879-CU İLDƏ (18.05.1474 – 06.05.1475) BAŞ VERMİŞ HADİSƏLƏR

Sultan Məhəmməd Qaraman bəylərbəyiliyini Məhəmməd paşa Rumiyə həvalə etmişdi. Həmin zaman Herakliyyə şəhərində çoxlu fəsadçılar peyda olmuşdu. O cümlədən Yüzbəyi [ləqəbi] ilə məşhur olan Ulaş oğlu Hüseyn bəy başına təxminən on min[1293] süvari toplayıb o diyarın ətrafına və yan-yörəsinə basqın edirdi və istila bayrağını qaldırmışdı. Ona görə də Məhəmməd paşa fəsadçılar dəf etməkdən ötrü Qaraman qoşunları ilə o yaraqsız quldurların məskəni olan Varsaq dağlarına yönəldi. Bir anda çoxlu qoşunla son dərəcə çətin bir keçidə daxil oldu. Onlar daş və ox zərbəsi ilə o tədbirsiz paşanı məğlub etdilər. Məhəmməd paşa min möhnətlə aradan çıxdı. Bu xəbər sultana çatdıqda o, Qaraman hakimliyini Bosnalı Məhəmməd bəyə lütf etdi.

O əsnada xəbər çatdı ki, Qasım bəy Qaramanoğlu igidlik meydanının bahadırlarından [ibarət] on min nəfərlə Larəndə şəhərinə daxil olmaq istəyir. Ona görə də Məhəmməd bəy onlardan öncə özünü Larəndə şəhərinə saldı. O əsnada Qaramanoğlu bir dəstə bahadırla şəhərin qarşısına gəldi. Elə bu vaxt Məhəmməd bəy şəhərdən çıxıb onunla vuruşdu. Döyüşdən və savaşdan sonra Qasım bəy müharibədən əl çəkib Herakliyyə tərəfə döndü və şəhərləri dağıtmaq, bəndələrə əziyyət verməklə məşğul oldu. Ona görə də Məhəmməd bəy yenidən onun üzərinə sürətli yürüş etdi. O zaman [Qasım bəy] Herakliyyədə idi.

Elə ki parlaq sübh, gümüşü qılıncın niqabını şüşəyə bənzər səmadan çəkdi, dan yeri ağartısının əli mavi rəngli göyün sidrəsini yırtdı, günəşin qılıncının nur çöhrəsi gecənin qır rəngli pərdəsindən çıxdı və Çin aynası (günəş) şərq üfüqündən və civə rəngli asimandan peyda oldu[1294],

Şeir

"Parlaq ay işığından cahan nurlandı,
Çıxdı ətir torpağın göbəyindən.
Boşaldı torpağın bazarı gurultudan,
Xoruzların banından asudə oldu qulaq.
Rəqiblər gecə yuxudan sərməst oldular,
Sadiq sübh başını suyun içinə çəkdi".

Qasım bəy qorxmaz qaramanlılardan və qantökən igidlərdən [ibarət] bir dəstə ilə onun üzərinə gecə basqını etdi. Təsadüfən ay işığı vardı. əsgərlərin hamısı görünürdü. Məhəmməd bəy arxasını Bolğar dağına[1295] verib ağır bir döyüş apardı.

Şeir

"Qara ilan qabığını çıxardıqda,
Dan yerinin Zöhhakı güldü.

---

[1293] M.Öztürkə görə: "iki min".
[1294] Mətnin bu yerində ziddiyyət vardır. Bu abzasda gündüz çağının təsvir edilməsinə baxmayaraq, sonrakı şeirdən və hadisənin təsvirindən belə anlaşılır ki, bu əhvalat gecə vaxtı baş vermişdir.
[1295] Türkiyənin Konya, Niğde vilayətlərinə və Mersin vilayətinin İçel ilçəsinə yayılmış bir dağ silsiləsi.

Çevik mübarizlərin əlində,
Nizə Zöhhakın ilanına döndü"

Qasım bəy bir iş görə bilmədiyindən Daşelinə yönəldi.

### Sultan Məhəmmədin İskodra üzərinə qoşun göndərməsi

Bu il Rum padşahı Sultan Məhəmməd Rumeli qoşununu İskodranı[1296] ələ keçirməyə göndərdi. Rumilər hiddət və qəzəblə qalanı üzük qaşı kimi dövrəyə aldılar və ürək deşən zərbzənin və atəş saçan topun zərbəsi ilə o qalanın bürclərini və divarlarını dağıtdılar. Qala əhli çarəsizlik üzündən mərdliklə səy göstərdi və qılıncların camından ölüm qurtumunu içdilər. Axırda Süleyman paşa[1297] o qalanı fəth etməkdən aciz qalıb köç edərək, sultanın fərmanı ilə Qara Boğdan diyarına yönəldi.

İskodra və Qara Boğdan arasında bir aylıq yol vardı. Ona görə də əsgərlər çox zəhmət çəkdilər və o diyara çatdıqda qarətə və taraca başladılar. Qara Boğdan hakimi[1298] çox qüvvətli bir kafir idi və kafir igidləri üzərində üstünlük iddiasına malik idi. O, Dəşti-Qıpçağın Çingiz xan soyundan gələn əzəmətli sultanları[1299], Engirüsün və Əflaqın böyük padşahları ilə qonşu olmasına baxmayaraq, əsla onlardan çəkinmirdi. Bu minvalla fasiləsiz şəkildə təxminən doxsan il o mülkdə müstəqil hakimiyyət sürmüşdü. O, Rum qoşununun gəlişindən xəbərdar olduqda dərhal müqavimət göstərmək və vuruşmaq üçün irəli gəldi. Dağı və düzü bürüyən, səba küləyinin nəfəsini fəzanın sinəsində sındıran, bəzisi dəniz kimi zireh geymiş, bir qismi isə balıq kimi cövşən taxmış bir qoşunla rumilərin qarşısında səf çəkdi.

Nəzm

"Qoşunun səfindən titrəmə düşdü dağa və düzə,
Və xəncərin istisindən dəniz və quru qaynamağa başladı".

Bayraqları qaldırdılar, şeypur və nağara çaldılar. Kosun heybətindən, ney və zəng sədasından az qaldı ki, fələk dairəsi hərəkətdən qalsın və yerin mərkəzi su kimi rəvan olsun. Ox kamandan dolu və yağış kimi yağmağa başladı. Ölüm ahəngli top və tüfəng daş və zindan ürəklərdə atəş yandırdı. Döyüşdən və vuruşdan sonra Rum qoşunu qaçış yolunu tutdu və onlardan bir çoxları qətlə yetirildi. Süleyman paşa pərişan və bədhal bir vəziyyətdə Ədirnə tərəfə döndü.

### Rum padşahı Sultan Məhəmmədin Gədük Əhməd paşanı Kəfəyə göndərməsi haqqında

Bu il Rum padşahı Sultan Məhəmməd, Gədük Əhməd paşanı döyüşçülərlə, topla və tüfənglə dolu olan iki yüz ədəd gəmi ilə İstanbul dəryasından (Mərmərə dənizindən) Kəfə[1300] tərəfə göndərdi. Onlar quru yolundan qalanı mühasirəyə aldılar və top-tüfəng zərbəsi ilə onun bürclərini viran etdilər. Qala əhli can qorxusundan qalanı təslim etdi. Paşa o vilayəti zəbt etdikdən sonra hərəkət bayrağını Səqalibə (slavyan) limanlarının ən böyüyü olan və kənarından Tin (Don) kimi məşhurlaşan çay axan Azaq (Azov) tərəfə qaldırdı.

Rum qoşunu o hüduda və o diyara çatdıqda Menkub[1301] qalasını əhatəyə aldı. Bir neçə gün sonra sözügedən qalanın hakimi[1302] qaladan çıxdı. Amma onun qohumlarından və yaxınlarından biri müxaliflik göstərib qalanı təslim etmədi. Paşa qalanın ətrafından köç etdi və pusquda bir dəstə qoydu. O əsnada müxaliflər qaladan endilər. Pusquda durmuş rumilər onların üstünə hücum edib əksərini gedər-gəlməzə göndərdilər və qalanı ələ keçirdilər.

---

[1296] İskodra (İşkodra) – Albaniyada şəhər *(Nəvai, şərhlər, s.783).*

[1297] Əvvəllər saray xacələrindən olmuş bu serb mənşəli şəxs həmin zaman Rumeli bəylərbəyisi idi. İskodra şəhəri isə italiyalı Antonio Lordanonun hakimiyyəti altında idi *(Nəvai, şərhlər, s.783-784).*

[1298] 1457-1504-cü illərdə hakimiyyətdə olmuş Moldova hökmdarı Böyük Stefan (Ştefan Çel Mare).

[1299] Krım xanları nəzərdə tutulur *(Öztürk, şərhlər, s.530).*

[1300] Kəfə (Kəffə, Kaffa) – Krımın indiki Feodosiya şəhəri. O zamanlar Genuyanın ticarət koloniyası idi *(Nəvai, şərhlər, s.786).*

[1301] Menkub – Krım yarımadasında yerləşən, həm də Qarasubazar adlanan qala. Sakinləri əsasən yəhudilərdən ibarət idi ***(М.Губоглу.** Турецкий источник 1740 г. о Валахии, Молдавии и Украине // Восточные источники по истории народов юго-восточной и центральной Европы. Том 1. Москва, 1964, с.149).*

[1302] Trabzon imperatorları nəslindən olan Aleksandr Komnen həmin zaman bu qalanın hakimi idi *(Nəvai, şərhlər, s.786).*

## 880-Cİ İLDƏ (07.05.1475 – 25.04.1476) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Sultan Hüseyn mirzənin Əhməd Müştaq üzərinə qoşun çəkməsi

Bu il Əhməd Müştaq müxaliflik göstərib Sultan Əhməd mirzənin və Sultan Mahmud mirzənin yanına elçilər göndərərək onlardan yardım istədi. Ona görə də Sultan Hüseyn mirzə, Əmir Əbdülxaliqi müvafiq bahadırlardan [ibarət] bir dəstə ilə Bəlx tərəfə göndərdi ki, o diyarı ondan alsınlar. Əbdülxaliq şəhərə daxil olduqda Əhməd Müştaq onun hərəkətlərindən və vəziyyətindən anladı ki, onun gəlişinin səbəbi nədir. Bu səbəbdən ona təklif etdi ki, şəhərdən çıxıb getsin və dedi ki, "mən fitnə-fəsad əhlinin ərz etdiklərini inkar edib özümü təmizə çıxarmaq üçün tezliklə dərgaha gələcəyəm".

Əmir Əbdülxaliq ali taxtın ətəyinə çatdı və Əhməd Müştaqdan görüb-eşitdiklərini məruzə etdi. Sultan Hüseyn mirzə bir neçə gün intizar gözünü yola dikdi ki, bəlkə, Allahın köməyi ilə Əhməd Müştaq müxaliflik çölündən vəfadarlıq və uzlaşmanın doğru yoluna gəlsin. Lakin onun öz vədini yerinə yetirmədiyi bəlli olduqdan sonra onu cəzalandırmağı qərara alaraq zəfər ayəli bayrağını Bəlxə doğru qaldırdı və Mirzə Bədiüzzamana Herat hakimliyini tapşırıb Əmir Moğolu şahzadənin xidmətində qoydu.

Xaqanın gəlişindən dəqiq surətdə agah olan Əhməd Müştaq şəhərin bürcünü və divarını möhkəmləndirib müdafiə olunmağı qərara aldı və Sultan Mahmudla Sultan Əhməd mirzənin yanına elçilər göndərib yardım istədi. O iki yüksək məqamlı padşah Bəlxi ələ keçirmək xəyalı ilə Əhməd Müştağın köməyinə yollandılar. Sultan Mahmud mirzə çay kənarına yönəldi və Sultan Əhməd mirzə hərçənd özü dərhal hərəkət etməsə də, Səmərqənd əmirlərindən və əsgərlərindən bir dəstəni Bəlx tərəfə göndərdi.

Xaqanın müzəffər bayrağının ayparası Bəlx hüdudunu nurlandırdıqda və Əhməd Müştağın qalada müdafiə olunmaq qərarına gəlməsi dəqiq surətdə bəlli olduqda, zəfərə yaxın olan xaqan alnını qırışdırıb mühasirə və müharibə alətlərinin tərtib olunmasını əmr etdi. O, şəhərin ətrafını əmirlər arasında bölüşdürdü və hər kəs özünün təyin edildiyi mövqedə qərar tutdu. Şərqin və qərbin xaqanı Şahhüseyn bürcü qarşısında mövqe tutdu. Əmir Əlişir Şütürxar darvazasını özünə düşərgə etdi. Digər əmirlər, dövlət ərkanı və Mərrix kimi hiddətli əsgərlər o qalanı mərkəz kimi əhatəyə aldılar və xəndəyin suyunu başqa tərəfə axıtdılar. Yasaqçılar [xəndəyi] hamar etmək üçün oraya ağac və çör-çöp atmağa başladılar.

Bu əsnada ərz etdilər ki, Sultan Mahmud mirzə zəfər bayraqlı bahadırlardan [ibarət] bir dəstə ilə Amudərya çayı kənarına çatmışdır və Əhməd Müştağa kömək etməyi qarşısına məqsəd qoymuşdur. Ona görə də hökmdar fərman verdi ki, Əmir Müzəffər Barlas müzəffər bahadırlardan [ibarət] bir dəstə ilə müxaliflərin qarşısına çıxsın.

Əhməd Müştaq bu xəbəri eşitdikdə cəsarətlənərək ayağını müxaliflik və nifaq vadisində möhkəmlətdi. O, hər gün lovğalıq və qürur küləyi ilə döyüş və savaş atəşini alovlandıraraq son dərəcə şücaət göstərirdi. Bu tərəfdən isə hər sabah günəşin nizə vuran şahsüvarı çalışqanlıq kəməndini dövr edən hasarı fəth etməkdən ötrü atdığı zaman Sultan Hüseyn mirzə dağ görkəmli bir atın belinə minib qalanı fəth etməyə cəhd göstərirdi. Hökmdarın məiyyətinin mülazimləri sipərləri və çəpərləri başlarına çəkərək döyüş və vuruş meydanına qədəm qoyurdular və igidlik əli ilə oxun tez uçan qartalını kaman yuvasından pərvaza gətirib onları düşmənlərin başlarındakı beyinlə yemləyirdilər.

O əsnada bir gün mərdanəliyin bədirlənmiş ayı olan Əmir Seyid Bədir zəfər əlamətli qoşunun igidlərindən [ibarət] bir dəstə ilə hücuma keçib, ürək deşən oxun ucu ilə istehkamın başında ox və daş atmaqla məşğul olan bir dəstəni məğlub etdi və əsas xəndəkdən keçib, cəsarət ayağını irəli qoyaraq, [xəndəkdən çıxarılmış] torpaq yığınının arasında qalan Şir Hacı xəndəyi kənarına qədər çatdı. İstədi ki, o xəndəkdən də keçsin və şücaət kəməndi ilə Şahhüseyn bürcünə çıxsın. Əhməd Müştaq vəziyyətin bu yerdə olduğunu gördüyü zaman öz qoşunun igidlərindən [ibarət] bir dəstəni bayıra göndərdi ki, Seyid Bədirlə vuruşsunlar. Onlardan biri əlində nizə tutaraq Seyid Bədirə həmlə etdi. Seyid onun nizəsini tutub elə bir tərzdə özünə sarı çəkdi ki, o şəxs üzüqoylu yıxıldı. Sonra onun sinəsinə oturub qılıncla başını kəsmək istədi. Qəflətən digər biri irəli gəldi və ona nizə uzatdı. O da həmçinin oturduğu yerdə əlini uzadıb, onun da nizəsini tutaraq əvvəlki qaydada [özünə sarı] çəkdi və onu yerə yıxdı. Onların hər ikisini öldürüb başlarını Fəridun əzəmətli xaqanın nəzərləri qarşısına gətirdi.

Xülasə, Bəlx qalası son dərəcə mətanətli olduğundan, mühasirənin müddəti üç-dörd ay çəkdi. Axşamdan səhərə qədər "hazır ol!" və "ayıq ol!" nərəsi Keyvan eyvanından keçirdi. Əksər vaxtlarda səhərdən axşama kimi döyüş alovu şölələnirdi. Həmin gecələrdə Qaracar [adı] ilə məşhur olan bir türkman hər gecə Şahhüseyn bürcünə çıxıb dövlətxana qarşısında söyüş söyürdü. O həzrət bir gecə üç-dörd mahir atıcıya əmr etdi ki, o bürcün qarşısında bir-birilərinə yaxın məsafədə dursunlar, qantökən oxlarını yaylarına qoysunlar və gecə Qaracar söyüşə və həqarətə başlayan kimi onu vursunlar. Bu tədbir təqdirə müvafiq düşdü və ox onun hülqumuna dəydi.

Sultan Mahmud mirzənin və Sultan Əhməd mirzənin köməyinin əhvalatı isə belədir ki, Əmir Müzəffər çay kənarında Mavəraünnəhr qoşununun sudan keçməsinə mane olduğu günlərdə bəzən onun adamları gəmiyə oturub dəryanın (Amudərya çayının) ortasına gedərdilər və o tərəfdən də Əmir Məhəmməd Barlas irəli gəlib sülh və hərb barəsində söhbət edərdilər. Bir gün qərara alındı ki, bu tərəfdən Əmir Müzəffər Barlas və o tərəfdən Əmir Məhəmməd Barlasla Əmir Cahangir Barlas gəmiyə oturub vasitəsiz olaraq danışıq aparsınlar və sülhün əsasını möhkəmlətsinlər. Qeylü-qal əsnasında qəflətən sərt bir külək əsdi və ixtiyarsız olaraq Əmir Müzəffər Barlasın gəmisini müxaliflərin tərəfinə apardı. Belə ki, hərçənd gəmiçilər səy göstərsələr də, gəmini saxlaya bilmədilər. Sultan Mahmud mirzənin çay kənarındakı adamları şeypur çaldılar. Əmir Müzəffər özünü suya atdı və öz ordusuna doğru üz tutdu. Müxaliflər ox atmağa başlasalar da, ona bir zərər dəymədi və o tərəfdən nökərlərindən birinin suya saldığı bir atın vasitəsilə nicat sahilinə çıxdı. Amma gəmidə olan bir sıra ordu sərdarları Sultan Mahmud mirzənin əsgərlərinin əlinə düşdülər.

Bu əsnada mühasirə əyyamının uzanması ucbatından hökmdarın ordusunda böyük bir qəhətlik baş qaldırdı. Azuqənin olmaması ucbatından əsgərlərin döyüş gücü yox oldu. Macal tapan hər kəs qaçış yolunu tutdu[1303]. Belə ki, qalibiyyətli sultanın üzəngisinin həndəvərində iki min nəfərdən artıq adam qalmadı. Əmir Müzəffər Barlasın ulduzlar kimi möhtəşəm orduya gəlişindən sonra itaəti vacib olan fərman verildi ki, Əmir Əlişir Herata gedib mümkün qədər Xorasan vilayətindən taxıl toplayaraq orduya göndərsin. O cənab buyruğa əməl edib iki-üç min xərvar taxıl hasil etdi və ərəb qəbilələrinin dəvələrini kirayə götürüb Bəlx tərəfə yolladı.

O zaman ki Əmir Əlişir şəhərdə idi, Teymuri şahzadələri silkindən olan Mirzə Əbülxeyr yağı olub (qiyam edib) Heratdan qaçdı. Əmir Əlişir onu təqib edib Tanrının köməyi ilə ələ keçirdi və İxtiyarəddin qalasında həbsə saldı.

Əmir Müzəffər Amudərya çayı kənarından döndüyü zaman Sultan Əhməd mirzə Səmərqənd qoşunu ilə Sultan Mahmud mirzəyə birləşdi və hər iki qardaş birlikdə Amudərya çayını keçmək və qədəmlərini irəli qoyub döyüş atəşini alovlandırmaq istədilər. Bu xəbərləri təhqiq etdikdən sonra Sultan Hüseyn mirzə ay kimi gəzən təvaçıları Herata göndərdi ki, hakimlərə və daruğalara o hüdudun qoşunlarını toplayıb dərhal müzəffər məiyyətə qoşulmalarını söyləsinlər. O tərəfdən Sultan Mahmud mirzə çay kənarında müzəffər ordudan kimsənin qalmadığını gördükdə Əmir Əyyuba min nəfərlik yaxşı silahlanmış süvari ilə çaydan keçməyi və zəfər əlamətli ordugaha gecə basqını etməyi əmr etdi. O, yola düşüb öz-özünə qərar verdi ki, igidlik ayağı ilə Müştaqi çayını keçib, hökmdarın ordusuna daxil olaraq qılınca və oxa əl atsın. Təsadüfən, bir gün şam namazı vaxtı alinəsəb xaqan dağ görkəmli ata oturub döyüş mövqelərinin ətrafında dolaşırdı. Gözü Müştaqi körpüsünə sataşdıqda onun dağıdılmasını əmr etdi.

Zülmət hindlisi işıqlıq qoşununa qələbə çaldı, təzə-tər ənbər bənövşə rəngli zülfə və qıvrım telə qarışdı, məşşatə[1304] kimi gecə və qaranlıq gəlininin telini daradı, ulduzlar bu mavi rəngli səmaya gümüş həmail saldılar və süd arxları fələyin (göy üzünün) çəmənində axmağa başladı. Sanki fələyin mavi rəngli səhrasının üstünə Çin aynalarının əksi düşmüş və ya zəbərcəd[1305] lövhə nurla yüklənmişdi. Əmir Əyyub həmin min nəfərlə o çayın kənarına çatdı. [Körpünün] viran olduğunu gördükdə, xəyal etdiklərini həyata keçirə bilmədilər və həmin yerdə şeypur çalıb geri döndülər. O həzrət onu təqib etmək üçün bir dəstə təyin etdi. Onlar onun paltarını və yarağını ələ keçirib gətirdilər. Sonra şahzadələr bundan xəbər tutub bəla aqibətli qoşunla [çayı] keçməyə başladılar.

---

[1303] Paris nüsxəsində qeyd edilir ki, sultan azuqə gətirmək üçün əsgərlərini hər tərəfə göndərirdi və bəziləri bunu fürsət bilib aradan çıxırdılar.

[1304] Məşşatə – gəlinləri və qızları bəzəyən qadın.

[1305] Zəbərcəd – qızıla çalan yaşımtıl rəngli qiymətli daş.

Sonra Sultan Hüseyn mirzə düşmənlərin hərəkətindən agah olub, belə qərara gəldi ki, Mürğab çayı kənarına tələssin və müzəffər qoşunların toplanmasından sonra köhlən atının yüyənini müxaliflərlə döyüşə çevirsin. O, bu niyyətlə Bəlx ətrafından köçüb Gəzbəsan dərəsi və Çaharyek yolundan irəlilədi və oradan da hərəkət etdikdən sonra Faryab hüdudunda onun müzəffər əsgərləri düşərgə qurdular. Mirzə Əbu-Bəkr həmin yerdə Sultan Hüseyn mirzənin ona göstərdiyi qayğıkeşliyin üzərindən unutqanlıq xətti çəkərək fərar etdi.

Kama çatmış hökmdar Faryab hüdudundan köçüb, Gərmaba daxil oldu və belə məlum oldu ki, Sultan Əhməd mirzə ilə Sultan Mahmud mirzə çayı keçib Bəlx ətrafına getmişlər. Amma təsəvvürlərin əksinə olaraq, Əhməd Müştaq şəhər qapısını onların üzünə açmadı. Sultan Mahmudla Sultan Əhməd həmin şəhəri fəth etməkdən ümidlərini üzüb basqın etməkdən ötrü fələk mərtəbəli məiyyətin ardınca hərəkətə gəldilər. O həzrət ehtiyat üçün müzəffər üzəngisinin həndəvərindəki mülazimlərə cəbbə geydirib Gərmabdan Çiçəktuya[1306] getdi və oradan Sərpüli-Tabana[1307] yönəldi. Yol əsnasında Bədiüzzaman mirzə və Əmir Moğol iki min süvari və piyada ilə Heratdan gəlib çatdılar. Sonra qalibiyyətli xaqan Mürğab çayından keçib çayın kənarını müzəffər ordunun düşərgəsinə çevirdi. Həmin yerdə Maruçaq və Badğis vilayətlərinin qoşunları ordunun ətrafında toplanıb, hökmdarın ordusuna birləşdilər. Hökmdarın çay kənarında olduğu müddətdə hər gün Xorasan vilayətlərinin əsgərləri dəstə-dəstə öz hakimləri və sərdarları ilə birlikdə xilafət əlamətli taxtın ətəyinə gəlirdilər və xeyir-dua etmək üçün dil açırdılar. O həzrət onları döyüşə və vuruşa hazırlayırdı.

O tərəfdən isə Sultan Əhməd mirzə və Sultan Mahmud mirzə Gərmab mənzilinə çatdıqda və müzəffər qoşunun toplanmasından xəbərdar olduqda onların ürəyini böyük bir vahimə bürüdü. Eyni zamanda Mavəraünnəhr tərəfdən xəbər gəldi ki, hökmdarın məiyyətindən fərar etmiş Mirzə Əbu-Bəkr Bədəxşana çatdıqda bir ordu toplamış və Hisari-Şadmanı ələ keçirməyi qarışısına məqsəd qoymuşdur. Ona görə də qardaşlar zəfər nişanlı qoşunu təqib etməkdən peşman olub, yüyənlərini döyüş meydanından çevirərək Mavəraünnəhrə tərəf yola düşdülər. Onların geri çəkilməsi xəbəri o həzrətin nəzdində doğru çıxdıqda Əmir Müzəffər Barlası ulduzlar kimi əsaslı bir ordu ilə düşmənləri təqib etməyə göndərdi.

Əmir Müzəffər, sultanın buyruğuna əməl edib Bəlx ətrafına qədər yüyənini dartmadı. O, Sultan Əhmədlə Sultan Mahmuda çatmasa da, onların bəzi əsgərlərinin əşyalarını ələ keçirdi. Sonra Əhməd Müştağın yanına elçi göndərdi və ona nəsihət verdi ki, bundan artıq xilaf və nifaq yolunu tutmasın, uzlaşma və ittifaqın doğru yoluna gəlsin. Əhməd Müştaq da bu inadkarlığından və təkəbbüründən peşman olduğu üçün belə cavab verdi:

- Mənim bu cəsarəti və cürəti göstərməkdə məqsədim bu idi ki, hökmdarın nurlu könlünə aydın olsun ki, mənim əlimdən bir iş gəlir və Əmir Əbdülxaliq məkr və hiylə ilə məni bəla bəndinə sala bilməz.

Sonra iki tərəf arasında əhd-peyman meydana gəldi. Əhməd Müştaq, Bəlxi Əmir Müzəffərə təhvil verib, hökmdar ordusuna doğru üz tutaraq qılınc və kəfənlə xilafətin məskəni olan astanaya gəldi. Sultan Hüseyn mirzə dağ kimi mərhəmətinin və bol-bol hüsn-rəğbətinin son dərəcə çox olması üzündən onun günahları üstündən əfv və bağışlanmaq qələmini çəkdi və onun qabiliyyətli qamətinə səxavət və bəxşiş caməxanasından (qarderobundan) ənam və ehsan xələti geyindirib onu ali mərtəbələrə çatdırdı.

Sultan Hüseyn mirzə Bəlxin ələ keçirilməsindən xatircəm olduqdan sonra o məmləkətin idarəçiliyini Mirzə Bayqaraya verdi. O cənab həmin diyara hərəkət etdi. Əmir Müzəffər Barlas isə asiman əsaslı astanaya geri gəlib bir müddət sonra fani dünyadan əbədiyyət aləminə köçdü. Elə bu zaman Əmir Məhəmməd Bərəndüq Barlas, Əmir Cahangir Barlasla birlikdə Sultan Mahmud mirzədən üz döndərib Herata gəldi və qalib sultanın razılıq gözü ilə qəbul edildi. Əmir Məhəmməd əmirülümərə mənsəbini əldə edib divanda bütün əmirlərdən daha əvvəl möhür vurdu (daha üstün oldu).

Həmçinin bu il Sultan Hüseyn mirzə, Sultan Əbu-Səid mirzənin Mirzə Əlaüddövlənin qızı Ruqiyyəsultan bəyimdən doğulmuş qızı Xanım bəyimi Bədiüzzaman mirzə ilə evləndirdi.

---

[1306] Çiçəktu – Meymənə yaxınlığında, Bəlx – Herat yolu üzərində yerləşir *(Seddon, şərhlər, s.220).*
[1307] Hazırda Əfqanıstanda, Şibirğandan cənubda Sərpül (Səri-Pül) adlı bir yer var.

878-ci il aylarında (29.05.1473 – 17.05.1474) Kirman vəzirzadələrindən olan və Sultan Əbu-Səid zamanında müstövfilik[1308] mənsəbini icra edən Xoca Əfzələddin Məhəmməd vəzir olmuşdu. O, Xoca Nizamülmülklə birlikdə ölkə tutan xaqana Xoca Məhəmmədin mənimsəmələri barədə sözlər çatdırdı və bu kəlmələr təsirini göstərdi. Xoca Məhəmməd istintaqa çəkildi və həmin günlərdə Sultan Hüseyn mirzə o hadisənin sorğu-sualını apardı. Xoca Nizamülmülk və Xoca Əfzəl eyni anda səma kimi uca taxtın ətəyində Xoca Məhəmmədə qarşı çıxış edib mühasibatla bağlı hay-küy saldılar. Ədalətin pənahı olan padşah buyurdu:

- İnsafın yolu budur ki, onunla tək-tək danışasınız və ikiniz birlikdə onu susdurmağa çalışmayasınız.

Xoca Məhəmməd qalxdı və diz çökdü. O məclisdə Xocanın bir təqsir işlədiyi sübut olunmadı. Sultan Hüseyn mirzə onun azad edilməsi haqqında fərman verdi. Belə qərara alındı ki, təşəkkür əlaməti olaraq, ona altmış min qəpik (kəpəki) dinar ödənsin və o, divan işlərinə müdaxilə etməsin.

Mirzə Əbu-Bəkr Faryab mənzilində müzəffər üzəngindən ayrıldıqdan sonra Hisari-Şadman hüduduna tələsib o vilayətin sakinlərinin namusuna və malına əl uzatdı və Sultan Mahmud mirzənin qayıdışından sonra müqavimət göstərməyə tab gətirməyib Bədəxşan dağlarına pənah apardı.

## 881-Cİ İLDƏ (26.04.1476 – 14.04.1477) BAŞ VERMİŞ HADİSƏLƏR

### Rum padşahı Sultan Məhəmmədin Firəng padşahı Qara Boğdanla müharibə etməsi

Fərvərdin[1309] [ayında] bütün yer üzü çoxlu əlvan bitkilərlə naxışlandı, bağlar təravətin və canlanmanın çoxluğundan təzə və gülümsər oldular, su hövzələri susuzluqdan sonra sudan doydular və yüyənlərini açdılar, güllər dürr saçmağa, bülbüllər gülüstan süfrəsinə alqış deməyə, qocalar güllərin iyini alaraq gəncləşməyə və cavanlaşmağa başladılar.

Şeir

“Qumru sərvin başından nəğmə oxuyur bostana,
Bülbül fəğan edib çəməndə qovğa salmış.
Gül cilvə edir, hər tərəfdə gözəllik və lətafət,
Çəmən gözəlləri onun camalına valeh ve vurğun.
Baharın naqqaşı sənətkarlıqla qələm çəkmiş,
Gül qönçəsindən bu göy qübbəsinin surətini”.

Belə bir fəsildə Rum padşahı Sultan Məhəmməd yağış damcılarından daha artıq sayda bir qoşunla tüğyanla dolu Qara Boğdan valisini dəf etməyə yollandı. Günəş nişanlı bayraqlar cahanı dolaşan günəş kimi hərəkətə gəldilər ki, Qara Boğdan diyarını ələ keçirmək və oranın pozğun kafirlərini qırıb-biçmək üçün tam səy və sözlə ifadəsi mümkün olmayan cəhd göstərərək o diyarı onların mövcudluğunun xəbisliyindən pak etsinlər. Tuna çayını keçib köçə-köçə müxaliflərin üzərinə yönəldilər. O diyarın camaatı can qorxusundan dağlara və meşələrə pənah apardılar.

Nəzm

“Çöldə yaşayanlar zərər qorxusundan,
Mənzil tutdular uca dağda.
Sahil igidləri savaşdan qorxub,
Dənizə üz qoydular timsah kimi.
Şəhər əmirləri zamanın qarışıqlığından,
Bağladılar qorxudan şəhər qapılarını.
Rəiyyət xərac qorxusundan çəkinərək,
Öz işlərinin yaxşısından və pisindən əlacsız oldular”.

Qara Boğdan hakimi sultanın yolu üstündə yerləşən bütün məmləkətinə od vurdu. Belə ki, orada taxıldan və otdan əsər qoymadı.

---

[1308] Müstövfi – dövlətin maliyyə məmuru. Maliyyə idarəsinin müdiri və bütün müstöfvilərin başçısı müstövfiül-məmalik adlanırdı *(О.А.Эфендиев. Азербайджанское государство Сефевидов, с.262-263; Z.Veliyeva. Safevî devlet teşkilatı: Tezkiretü’l-Mülük’e göre. Doktora tezi. Ankara Üniversıtesi Sosyal Bilimler Enstitüsü, 2007, s.264-272).*

[1309] İran günəş (şəmsi) təviminə görə, baharın ilk ayı.

Beyt

"Hər kim od vursa öz evinə,
Başqalarının da evini bada verər.
Və o adam ki öz mənzilini dağıdar,
Onun uğursuzluğu bir aləmə fəsad bəxş edər".

Sultanın qoşunu o yerə çatdıqda ərzaq çatışmazlığı ucbatından çox məşəqqət çəkdilər. Amma sultan hökm etmişdi ki, taxılla və qida məhsulları ilə dolu olan müqayisəyəgəlməz gəmilər İsgəndər (Üsküdar) boğazından Qara dənizə keçərək Tuna çayı tərəfə, qoşunun yolunun üstünə gəlsinlər. Ona görə də aclıq şiddəti aradan qaldırıdı. Sultanın yolu elə bir təhlükəli yerə düşdü ki, düşüncə və xəyal aynası o diyarın ətrafında qulyabanı və div çöhrəsindən başqa bir şey görmürdü və biliyin hifz olunmuş lövhəsində, yəni könül aynasında onun meşəsini və təpəsini necə adlamağın yolu bilinmirdi.

Nəzm

"Onun təpəsini görmək, gözün imkanı daxilində deyildi,
Onun meşəsinin darısqallığı, düşüncənin keçidinə imkan vermirdi.
Şir istədi ki, görsün oranın sonunu əyani şəkildə,
Bədəvi külək onun dərisini soyub apardı.
Onun səmum küləyi Simurqun qanadını yandırdı,
Belə ki, o, məhşər vaxtına qədər uçmaqdan məhrum oldu".

Sultanın qoşunu nə qədər o diyarda gəzib-dolaşsa da, əsla bir kimsəni ələ keçirə bilmədi. Çünki ordu və rəiyyət öz vətənlərini elə tərk etmişdilər ki, xeyir və şər xəbərləri öyrənmək üçün heç vəchlə heç bir mənzildə bəşər növündən bir kəsi tapmaq mümkün olmadı.

Bir gün qoşunun bələdçisi yolu itirdi. Sultan çox əsəbiləşdiyi üçün o bələdçinin qətlinə fərman verdi. Təsadüf elə gətirdi ki, qəflətən düşmənlərə rast gəldilər. Qara Boğdan hakimi öz adamlarının hamısını ağacların arasında yerləşdirmişdi, dərin xəndəklər qazdırmışdı, taxtadan möhkəm bir hasar ucaltmışdı, topla və zərbzənlə dolu arabaları öz önünə qoydurmuşdu.

Şeir

"Daşdan və taxtadan bir divar hördürmüşdü,
Hətta küləyin gəliş-gediş yolunu bağlamışdı.
Müdriklərin təfəkkürü bu yolda itib-batıb,
Onun ətrafında səba küləyi yolunu azıb".

Zəfərə yaxın olan əsgərlər o lənətəgəlmiş kafirlərə həmlə etdikdə, o düşmən kafirlər bir anda Rum ordusuna top, tüfəng və zərbzən atdılar və havanın üzünü özlərinin qara ürəkləri kimi tutqun və qaranlıq etdilər.

Beyt

"Çatdırdılar o yerin kafirləri,
Firəngi (top)[1310] sədasını uca göylərə.
Tüfəng tüstüsündən kin buludu yağış yağdırdı,
Lakin onun damcıları başdan-başa şər-xəta idi".

Pozğun kafirlərin toplarının və tüfənglərinin yerləşdiyi məkan yüksək bir vadi olduğu üçün əksər top-tüfəng gülləléri və oxlar rumilərin bayraqlarına və nizələrinə dəyir, əsla süvarilərə zərər vermirdi. Ona görə də sultan öz nəfis vücudu ilə onlara həmlə etdi. Bu səbəbdən dərgah əmirləri, yüksək məqamlı paşalar və ordunun qalan hissəsi qəzəb və hiddətlə o lənətəgəlmiş müşriklərin üzərinə at çapdılar. Yeniçərilər də hərb meydanını top və tüfəngin şər-xətası ilə isitdilər. Tüfəng mərmisi gətirdiyi hər xəbəri sirr kimi ürəyə oturdurdu. İti mizraq can gülşənində polad fidan əkirdi. Ürək alan ox göz bəbəyinə sirr açırdı. Sonra Gədük Əhməd paşa və yeniçərilərin sipəhsaları (sərkərdəsi) Mahmud ağa özlərini taxta hasara yetirib, o taxtaları aşırdılar. Ona görə də kafirlər naçar qalıb, üzə çıxdılar və qılıncların, nizələrin qəbzəsinə əl ataraq, canlarını təhlükəyə qoyub döyüşə və vuruşa atıldılar. Mərdliklə səy göstərdilər və qılıncların camından ölüm qurtumu

[1310] Burada "firəngi" dedikdə Avropa istehsalı olan və ya Avropa üsulu ilə hazırlanmış artilleriya nəzərdə tutulur.

içdilər. Rumilərin atəş saçan nizəsinin parıltısından çıxan alov şölələri bəxti dönmüş kafirlərin bədənlərinin meşəsinə düşürdü, fəsad neştəri kimi xəncərin ucu kafirlərin boğazına girirdi və o mərdimazar qövmün arteriya damarlarından qan fəvvarəsi fışqırırdı. Qaya deşən oxun ucu badam şəkilli göz oyuğunun içinə püstə kimi daxil olurdu.

Döyüşün gedişində taxta hasar yıxıldığından, rumilər onların canına daraşıb o qaragün qövmü dəstə-dəstə ikidilli qılıncla gedər-gəlməzə göndərdilər. O gün səhərdən axşamacan hərb və zərb atəşi alovlandı və asimandan yağış yerinə tüfəng və ox yağdı. Axırda Qara Boğdan hakimi qaçış yolunu tutdu. Rum ordusu onu təqib edib çoxlu mallar və saysız əsirlər ələ keçirdi. Sultan iki ay müddətində o azğın kafirin ardınca Qara Boğdan məmləkətini gəzib-dolaşdı. Qış yaxınlaşdıqda isə sultan geri dönüb orduya [öz yerlərinə] qayıtmağa icazə verdi.

Bu əsnada Engirüs kafirlərinin sərhədindən, Semendire hakimi Əli bəy Mixaloğlunun yanından qasid gəlib dedi ki, Engirüs padşahı Tuna çayı kənarında, Morda (Sava) çayının [Tuna çayına] töküldüyü yerdə, Boluca qalası[1311] [adı] ilə tanınan ərazidə taxtadan iki qala tikdirmişdir. Ona görə də yüksək şöhrətli sultan o diyara yönəldi və qısa müddət ərzində o qalaları ələ keçirib yenidən Ədirnə tərəfə döndü.

## 882-Cİ İLİN (15.04.1477 – 03.04.1478) HADİSƏLƏRİ

### Rum diyarında baş vermiş hadisələr

Bu il Rum padşahı Sultan Məhəmməd, Süleyman paşanı çoxlu qoşunla İnəbəxti[1312] vilayətinə basqın etməyə göndərdi. O diyarın kafirləri xeyli vuruşduqdan sonra rumilərə qalib gəldilər və Süleyman paşa məğlub olub yorğun və pərişan bir halda İstanbula qayıtdı.

Həmçinin bu il Sultan Məhəmməd, Mixaloğlu Əli bəyi, İsa bəyi, Həsən bəyi və Balı bəy Malqoçoğlunu otuz min nəfərlik yaxşı silahlanmış bir süvari dəstəsi ilə yolladı ki, Əflaq yolundan lənətəgəlmiş Engirüs vilayətinə getsinlər və o diyarı qarət etsinlər.

Onlar əmrə uyğun olaraq, Engirüs vilayətinə daxil oldular və o vilayəti dağıdıb qarət etməyə başladılar. O zaman Engirüs kralı o tərəfin böyük çölünü əlində saxlayaraq, ordusunun olmaması ucbatından islam ordusuna qarşı müqavimət göstərmək məqamına gəlmədi. Ona görə də böyük əmirlər qənimət ələ keçirməyə üz tutdular. Əmirlərin başı qənimət toplamağa qarışdığı üçün Engirüs kralı zəlalət əhlindən [ibarət] çoxlu ordu ilə islam ordusunun qarşısına çıxdı. Sərkərdələr bir-biriləri ilə ülfətə və ittifaqa malik olmadıqları üçün birlik nümayiş etdirə bilməyib aradan çıxdılar. İgidlikdə və cah-calalda özünü hamıdan öndə bilən İsa bəy krala müqavimət göstərmək üçün dayandı və kafirlərin kralı barədə xəbəri digər adlı-sanlı əmirlərə çatdırıb onlardan kömək istədi. Lakin döyüş meydanına yetərincə islam əsgərləri toplanmadı.

Əmirlərdən heç biri geri gəlmədi. İsa bəy bu həyatdakı son nəfəsində Allah yolunda səy göstərdi. Çox çalış-vuruşdan sonra qoşunun sərdarı (İsa bəy) şəhidlik dərəcəsinə çatdı. Onun bir sıra bahadırları da fanilik camından ölüm qurtumu içdilər. Əli bəy Mixaloğlu və b. əmirlər qaçmağa üz qoydular. Kafirlər Tuna çayına qədər [onları] təqib etdilər. Sultan bu xəbəri eşitdikdən sonra Əli bəy Mixaloğlunu otuz min süvari ilə Engirüs diyarına basqın etməyə göndərdi. Onlar da məğlub olub İstanbula qayıtdılar[1313].

Həmçinin bu il Sultan Məhəmməd Semendireyə yollandı və o vilayətin qalalarını ələ keçirib geri döndü[1314].

---

[1311] Nuruosmaniyyə nüsxəsi: "Qoyluca". Matyas Korun, Sabaç (türkcə Böyürdələn) qalasını ələ keçirdikdən sonra Semendire yaxınlığında bir neçə taxta qala inşa etdirdi. Görünür, "Boluca" həmin qalaların inşa edildiyi Omolicika yer adının təhrif olunmuş formasıdır *(Nəvai, şərhlər, s.800).*

[1312] İnəbəxti (İnebahtı) – Yunanıstanın Korinf körfəzindəki Lepante qalası. Həmin vaxt qala Venesiyanın idarəsi altında idi *(Nəvai, şərhlər, s.801).*

[1313] Müəllif burada iki hadisəni bir-birinə qarışdırmışdır. Belə ki, 12 paşanın başçılıq etdiyi Osmanlı qüvvələrinin Rumıniya və Macarıstana yürüşü 1479-cu ildə olduğu halda, Əli bəy Mixaloğlunun Macarıstana səfəri və məğlubiyyəti 1476-cı ildə baş vermişdi *(Nəvai, şərhlər, s.803).*

[1314] Burada bir yanlışlıq vardır. Çünki həmin il Osmanlı sultanı Semendere tərəfə yürüş etməmişdir *(Nəvai, şərhlər, s.803).*

**Ölümlər**

Həsən padşahın oğlu Uğurlu Məhəmməd bu il Ərzincana yollandı və o zaman həmin həndəvərdə olan türkman əmirlərindən Bayandur bəy onun hüzuruna tələsib, Həsən padşahın möhtərəm hərəmi və onun bütün övladlarının anası olan Səlcuqşah xanımın əmrinə əsasən, ona qəsd etmək üçün fürsət gözləməyə başladı. Bu əsnada bir dovşan yerindən sıçradı. Bayandur bəy yaya ox qoyub o tərəfə atmaq istəyərkən Uğurlu Məhəmmədin sinəsinə vurdu. O, atdan yıxılıb əbədiyyət aləminə yollandı. Bayandur bəy onun başını bədənindən ayırıb Həsən padşahın yanına göndərdi. Ərzincan əhalisindən bir şəxs onun Rum padşahının qızından doğulmuş oğlu Gödə Əhmədi anası ilə birlikdə götürüb Sultan Məhəmmədin hüzuruna apardı.

Həmçinin bu il Həsən padşah ibn Əli bəy ibn Qara Osman ibn Qutluq bəy ibn Turəli bəy ibn Pəhləvan bəy Gürcüstana qarşı qəzavata gedib, seyidlərdən, şeyxlərdən və soyurğal əhlindən olan hər kəsi özü ilə apararaq Gürcastan vilayətini ələ keçirdi və çoxlu əsirlər tutaraq, seyidlərdən və şeyxlərdən hər birinə pay verib geri döndü[1315]. Fitr (Orucluq) bayramı gecəsində (05.01.1478) o, əcəl saqisinin əlindən ölüm qurtumunu içdi. “Biz Allahınıq (Allahın bəndələriyik) və (öləndən sonra) Ona tərəf (Onun dərgahına) qayıdacağıq!”[1316]. O, özü tərəfindən salınmış Nəsriyyə bağında dəfn edildi. Ömrünün əyyamı əlli il idi. Anası Saray xanımdır.

Beyt

“Vəfatının tarixi üçün hər kəs,
“Dinpərvər, adil şah” dedi”[1317].

O, şövkət sahibi olan bir padşah idi və sözlə ifadəsi mümkün olmayan bir ədalətə malik idi. Alimlərlə və fazillərlə məclislər qurardı. Onun məclisində hədisdən və təfsirdən söz açılardı. Özü də bu mövzuları bilirdi. Seyidlərə, şeyxlərə və alimlərə böyük ehtiram göstərirdi. Səltənət müddəti on bir il olmuşdur. Məmləkəti Diyarbəkr, Azərbaycan, İraqi-Ərəb, İraqi-Əcəm, Fars və Kirman idi.

Onun ölümündən sonra əmirlər və dövlət ərkanı Sultan Xəlili onun yerinə əyləşdirdilər. Sultan [Xəlil] Diyarbəkr hakimliyini Sultan Yaquba verdi və Süleyman bəy Bicənoğlunu onun lələsi[1318] [təyin] etdi.

[Həsən padşahın] yadigarlarından biri Təbrizdə tikdirdiyi məsciddir. Belə ki, padşahlardan heç biri yer üzündə bu cür feyzlə dolu bir imarət tikdirməmişdir.

Nəzm

“Nə gözəldir cənnət yelinin əsdiyi o pak rövzə,
Onun torpağı can qoxusu saçır.
Həmçinin onu görəndə göz cilalanır,
Həmçinin ətirindən ruhlar təzələnir.
Uca göy onun qübbəsinə yaxındır,
Günəşə və aya şəmsəsi qonşudur”.

Günəşin zərli teşti onun divarının zərnigar teşti qarşısında utandığından hər səhər qıpqırmızı qızarır və asimanın firuzə rəngi onun kaşısının laciverd parıltısına paxıllığından gömgöy göyərir. Sağdan və soldan bu məscidin işləmələrlə dolu iki minarəsi dövr edən səmaya baş aparır.

Nəzm

“Onun qarşısında Mərvə dəm vurur Səfadan,
O, iki barmağını qaldırıb “la” şəklində”[1319].

Həsən padşah zamanında xeyriyyə mərkəzində (büqeyi-xeyr) qida, libas və b. şeylər hasil edilər və hazır saxlanardı.

Nəzm

---

[1315] Nuruosmaniyyə nüsxəsində bu yürüş h. 881-ci ilə aid edilmişdir.

[1316] *Qurani-Kərim, “Bəqərə” surəsi, 156-cı ayə.*

[1317] “Şəhi-dinpərvəri-adil” = 882 h.

[1318] Şahzadələrin qəyyumu, tərbiyəçisi “lələ” adlanırdı. Azyaşlı şahzadələrdən hər birinə görkəmli əmirlərdən biri lələ təyin edilir, həmin əmir şahzadənin təhlükəsizliyi, təlim-tərbiyəsi, bir dövlət xadimi və şəxsiyyət olaraq yetişdirilməsi kimi məsələlərə cavabdeh olurdu.

[1319] Burada məscidin iki minarəsi ərəb əlifbasında “lam” və “əlif” hərflərinin birləşməsindən yaranan “la” kombinasiyasına bənzədilmişdir.

“Onun içində hər kəs köhnə libasdan ayrılır,
Yeni libaslar hazır edilmiş Tanrının xalqı üçün.
Ta ki oldu bu xeyriyyə binası peyda,
Bu şəhərdə köhnə paltar geyəni kim gördü?!
Bu bina ta dünyada oldu əyan,
Yoxsulluqdan asudə oldu cahan xalqı”.

Amma hicri tarixinin 980-ə (14.05.1472 – 02.05.1473) çatdığı indiki zamanda məscidin rövnəqi Həsən padşah zamanının əksinədir. Yadigarlarından digər biri Qeysəriyyədir ki, məharət şüarlı memarlar və xeyir əlamətli bənnalar bu gözəllikdə, bu ustalıqda və bu möhkəmlikdə bir imarətin bina edilmədiyi qənaətindədirlər[1320].

Bu sətirlərin müəllifi bəzi adamlardan belə eşitmişdir ki, Uğurlu Məhəmmədin başını Həsən padşahın yanına gətirdikləri zaman Həsən padşah xəstə idi. Onun xatirinə çox ağır gəldi və dedi ki, “əgər bu xəstəlikdən xilas olsam, onun qatillərindən intiqam alacağam”. Səlcuqşah xanım bu sözdən qorxub onu boğdurdu. Amma “Tarixi-aləmara”da[1321] yazılıb ki, Həsən padşah xəstəlik vaxtında o zaman Şirazda olan ən yetkin oğlu Sultan Xəlili çağırmış və səltənət işini ona həvalə etmişdi. O zaman onun oğullarından beş şahzadə həyatda idi: Sultan Xəlil, Maqsud bəy, Yaqub bəy, Yusif bəy və Məsih mirzə.

Sultan Xəlil səltənət taxtına əyləşdikdə məhbus olan Maqsud bəyi qətlə yetirdi və mərhum Həsən padşahın kədərli (ölüm) hadisəsini xəbər vermək və uzlaşma qaydalarını yeniləşdirmək üçün Qazı Əlaəddin Beyhəqini Rum padşahı Sultan Məhəmmədin hüzuruna göndərdi. Fars hakimliyini öz oğlu Əmirzadə Əlvəndə tapşırdı. Hüseyn bəy Xocahacılu və Əmirzadə Qəzənfər Miranşahi kimi bəzi böyük əmirləri, Bayanduri əmirlərindən Abbas bəyi, Yusif bəyi, Bəhram bəyi, Hüseynəli bəyi və xəzinədar Məhmat bəyi, Qaraqoyunlu əmirlərindən Məhmat bəy Alpavutu və digər əmirləri Şiraza yolladı. Şahzadənin dolanışığı üçün beş min Təbriz tüməni məbləğ ayırdı. Qalan vilayətləri isə bundan öncə Şirazın hökumət işlərini icra edən Bəkir bəy Mosullunun iqtidar əlinə tapşırdı və Fars vəzirliyini Şah Şərəfəddin Mahmudcan Deyləmiyə lütf etdi.

## 883-CÜ İLDƏ (04.04.1478 – 24.03.1479) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Cahangir oğlu Murad bəyin Sultan Xəlilə qarşı müxaliflik etməsi

Bu il Həsən padşahın qardaşı oğlu Murad bəy ibn Cahangir bəy, Sultan Xəlilə qarşı müxaliflik etməyə başladı. Qaraqoyunludan, kürdlərdən və türklərdən çoxlu qoşun o qorxmazın yanına toplandı. Murad bəy fitnəkar adamların sözləri ilə Savədən Təbrizə doğru hərəkətə gəldi. Sultan Xəlil bu xəbəri eşitdikdə Mənsur bəy Pornakı çevik igidlərdən [ibarət] bir dəstə ilə o qaniçəni dəf etməyə yolladı. Sultaniyyə çəmənində iki qoşunun [bir-birinə] yaxınlaşması qarşıdurma ilə nəticələndi. Döyüş atəşi alovlandı. Qələbə yeli Murad bəyin bayrağının pərçiminə əsdi. Mənsur bəy Pornak məğlub olub qaçış yolunu tutdu.

Bu xəbər Sultan Xəlilə çatdıqda o, çoxlu ordu ilə Miyanəyə yönəldi. Murad bəy onların hərəkətindən agah olub, müqavimət göstərməyi lazım bilməyərək zərurət üzündən acizlik əlini fərarilik ətəyinə vurdu, iti qılıncın qorxusundan atəş kimi ayaq açdı və aqibəti olmayan bir dəstə ilə külək kimi yer üzünü ötüb keçməyə başladı.

Beyt

“Görmədən uzaqdan qılınc şimşəyini,
Tülkünün şirdən qaçdığı kimi qaçdı”.

O, az adamla Firuzkuh qalasına getdi. Sultan Xəlil, Osman bəy Miranşahini o pis yolun yolçusunu dəf etmək üçün göndərdi. Osman bəyin o hüduda gəlişindən sonra o qalanın hakimi olan rəzil Hüseyn Kiya onun qoşunlarının qorxusundan Murad bəyi və onun yanında olan bir neçə əmiri tutaraq Osman bəyə təhvil verdi. Sözügedən ilin rəbiüləvvəl [ayının] 14-də (15.06.1478)[1322] onların boynunu vurub başlarını Sultan Xə-

---

[1320] Şərq ölkələrində ən gözəl və geniş bazar kimi şöhrət tapmış və əsası Uzun Həsən tərəfindən qoyulmuş “Qeysəriyyə” üstüörtülü və səkkizkünclü idi (bax: *S.Onullahi. XIII-XVII əsrlərdə Təbriz şəhəri. Bakı, 1982*).

[1321] Ağqoyunlu saray tarixçisi Fəzlullah ibn Ruzbehan Xuncinin “Tarixi-aləmarayi-Əmini” əsəri nəzərdə tutulur.

[1322] Nuruosmaniyyə nüsxəsi: “4-də”.

lilin məclisinə apardılar. Muradsız sultan, Muradın muradına çata bilməməsini özünün muradının hasil olmasının səbəbi bilib, tam arxayınlıqla oturmuşdu ki, İbrahim bəy Cahangirinin müxalifliyi haqqında xəbər gəldi.

Bu hadisə belə olmuşdur ki, İbrahim bəy Fars, İraq və Azərbaycan vilayətlərinin ələ keçirilməsinin naxışını öz arzularının səhifəsinə çəkib, öz hökumətinin və əyalətinin mərkəzi olan Kuhbənandan və Sircan ətrafından bir qoşun hazırlayaraq Babək şəhərinə yönəldi. Dəhəc[1323] qalasına çatdıqda, öz qardaşı Qasım bəyi sultana qarşı müxalif olmağa təhrik edərək onu özü ilə Babək şəhərinə gətirdi. Oradan Şirazı ələ keçirmək əzmi ilə Sircana yönəldi. Oradan Şiraz əmirlərinə bir məktub yazdı və bildirdi ki, o məmləkətə hərəkət etməsi onun ölkəsində taxılın bahalı olması ilə bağlıdır. O, həmçinin əmirlərdən yaşayışın təmin edilməsi üçün lazım olan bəzi mallar istədi. Əmirlər məktubu oxuduqdan sonra ona riayət etmək vəzifələrini yerinə yetirib onun istədiklərini göndərdilər. Onun istədiyi mallar gəldikdən sonra işin üstündən pərdəni götürüb, müxaliflik izhar edərək qəflətən Şiraza basqın etmək və o mülkü rəqiblərindən almaq istədi. Şiraz əmirləri bundan agah olub, döyüş ləvazimatını hazırlayaraq onun qarşısına çıxdılar və onun öncədən göndərdiyi bir qoşun dəstəsinə rast gəldilər. Onlar o dəstənin sərkərdələri olan Süleyman bəy Bayanduru və Çələbi bəyi öldürdülər. O camaatın qalanları sürətlə çaparaq özlərini İbrahim bəyə yetirdilər və hadisəni danışdılar. İbrahim bəy bildi ki, onun məqsədinin çöhrəsi murad aynasında cilvələnməyəcəkdir. O, öz qardaşı Murad bəylə görüşmək əzmi ilə Savəyə yollandı. İsfahan ətrafına çatdıqda, yol əsnasında Mənsur bəy adlı Ərdistan daruğası xam xəyala düşüb onu ələ keçirmək və Sultan Xəlilin qarşısında bir xidmət yerinə yetirmək istədi. Ona görə də başsız-ayaqsız türklərdən və Ərdistan piyadalarından bir dəstə toplayıb Cürbadəqan ətrafında İbrahim bəylə qarşı-qarşıya gəldi. İbrahim bəy bir həmlədə o güruhu bir-birinə vurub onların həyat damarını qopardı. Qum və Kaşan ətrafına çatdıqda xəbər tutdu ki, qardaşı zəmanənin cana nuş olmayan camından namuradlıq şərbətini içmiş və varlıq yükünü yoxluq məkanına çəkib aparmışdır. İbrahim bəy özünün tədbir yolunu itirib heyrət içində qaldı.

Sultan Xəlil də İbrahim bəyin Şiraz qoşunundan fərar etməsini öyrəndikdə ona qəsd etmək üçün ətrafdan və yan-yörədən qoşunlar göndərdi və onlar onu qəflətən tutaraq əsarət bəndinə saldılar. Sultan hökm etdi ki, o şahzadənin dərisini soyub onu müvəqqəti həyat libasından üryan etsinlər. O əsnada ardıcıl xəbərlər gəldi ki, Yaqub bəy və Süleyman bəy Diyarbəkr əmirləri ilə, böyük bir qoşunla ölkəni ələ keçirmək niyyəti güdərək Ərciş və Bəndi-Mahi[1324] ətrafına çatmışlar. Sultan Xəlilin intiqam almağa və yerində qalmağa macalı olmadı və o padşahzadə salamat qaldı.

### Yaqub padşahın Sultan Xəlillə müharibə etməsi haqqında söhbət

Yaqub padşah anası və qardaşı ilə birlikdə Diyarbəkrə yola düşdüyü zaman Bəndi-Mahidə Süleyman bəy qoşun və məiyyət, təbil və bayraqla Yaqub padşahın ordusuna qoşuldu və həmin gün köç edib Bitlisə yönəldilər.

O zaman dağ və meşə başına ağ kələğayı çəkdi. Çöl və səhra əyninə sincab libası geydi. Bağın və bostanın səthi kafur məkanına və civə çeşməsinə döndü.

Nəzm

“Səma öz üzünə bulud sincabını çəkdi,
Pərdə arxasında gizləndi cahanı işıqlandıran günəş.
Yandırıcı atəşin təsiri elə batil oldu ki,
Onun içində İbrahim möcüzəsi gerçəkləşdi”.

Əsgərlər qarı tapdalayıb ordunun keçidi üçün yol düzəltdilər. Qarın çoxluğu o həddə idi ki, o yolun üzərində yerləşən ribat qar altında qalıb görünməz oldu. Qoşunun keçidi üçün açılan yolda dəvənin hürgücü qar içində görünmürdü. Xidmətkarlar o darısqal yolda geri qayıda bilmirdilər ki, yeməkləri və içməkləri gətirib gəlsinlər və ona görə də qar içində tağçalar düzəldib yeməkləri və içməkləri oraya qoymuşdular ki, Yaqub padşah gələrkən onlardan istifadə etsin.

---

[1323] Dəhəc – İranın Kirman vilayətinin Şəhri-Babək (Babək şəhəri) şəhristanında yerləşən bir nahiyə mərkəzidir.
[1324] Van gölü çevrəsində bir yer adıdır *(Öztürk, şərhlər, s.545).*

Xülasə, Üveys Qərn məzarı[1325] mənzilinə çatdıqda yer üzündəki qar bir qədər azaldı. Hərzin mənzilində Qasım bəy Qaramani qoşun və məiyyətlə şahzadənin hüzuruna yetişdi. Əlahəzrət Bəşiri[1326] mənzilində dayandıqda Şeyxəli bəy Möhürdar Həsənkeyf adı ilə tanınan Hisni-Keyf hakiminin övladları ilə hüzura gəldi. Yenə bu mənzildə Bayandur bəyin oğlu Məhəmmədi bəy töhfələr və peşkəşlə gəlib büsatı öpmək şərəfinə nail oldu. Həmçinin Mardin hakimi Xalid bəy zəfər əlamətli ordugaha gəldi və o mənzildə Qurban bayramı qeyd edildi.

Ertəsi gün Bəşəridən köç edib Əbara yönəldilər. O vaxt Bayandur bəy hüzura gəlmək şərəfinə nail oldu və böyük əmirlər silkində qərar tutdu. Əbar mənzilində Ərqənin, Əlcəbəl, Baqi, Sivərək, Cermük, Ruha (Urfa), Cəmləm və s. kimi Diyarbəkr qalalarının və şəhərlərinin kutvalları, hakimləri və daruğaları büsatı öpmək izzəti ilə səadət tapıb qalaların və xəzinələrin açarlarını təqdim etdilər.

Sözügedən ilin baharında Yaqub padşah qışlaqdan qalxıb Azərbaycan, İraq, Fars məmləkətlərinin və s. bölgələrin fəthi niyyəti ilə yaylağa yollandı. O, Əbar çayı sahilində dayandıqda Həsənəli bəy Bayandur, Elaldı bəy Çepni və Bəkir bəy Duxarlu kimi bəzi əmirlər ali taxtın ətəyinə gəldilər və peşkəş təqdim edib padşahlara layiq xələtlərlə şərəfləndirildilər. Pambuqlu çayına[1327] çatdıqları zaman muştuluqçular Məhdi-Ülya Səlcuqşah xanımın xeyirli gəlişinin və onun Bitlis şəhərindən keçdiyinin xəbərini ərz etdilər. Bəşəri səhrasında dayandıqları zaman şahzadə anası ilə görüşmək sevincinə nail oldu. [Səlcuqşah] bəyim Yaqub padşahın müxaliflik niyyətindən agah olduqda oğlunu o iddiadan daşındırıb, Sultan Xəlilin hüzuruna elçi göndərərək itaət, tabeçilik və üzrxahlıq izhar etməsini məsləhət gördü. Sözügedən xəbərləri çatdırmaq üçün Hacı bəy Mosullunu təyin edib göndərdilər.

Elçinin göndərilməsindən qısa bir müddət sonra Vəfa Bukavul Təbriz tərəfdən gəlib belə bir yanlış xəbər çatdırdı ki, Sultan Xəlil, Murad bəyin qoşununun həmləsi qarşısında ağır məğlubiyyətə uğramışdır. Həmin xəbərə görə Yaqub padşahın əmirləri Təbrizə hərəkət etməyi qərara alıb köçə-köçə, coşqunluq və hay-küylə Muş səhrasına gəldilər. O mənzildə də Xurşid bəyin oğlu Yusif bəy, Məhəmməd bəy Duxarlu və möhtərəm əmirlərdən bəziləri adəti zəfər olan orduya qoşulub şahanə hüsn-rəğbət və xələtlərlə şərəfləndirildilər. Fərat sahilinə çatdıqları zaman Pir Əziz Qaraca Təbrizdən gəlib, Murad bəyin sultanın qarşısından qaçdığı və onun Firuzkuha sığındığı haqqında xəbər gətirdi.

Sözügedən xəbərin dəqiq olduğu müəyyənləşdikdə, sultana qarşı müxalif çıxmağı məsləhət görmüş adamlar məyus olub qorxuya düşərək heyrət dənizinə batdılar. Bu işə razı olmayan və bəzən mane olmağa çalışan kimsələr isə xoşhal olub öz rəylərinin səmərəsini görəcəklərinə ümidvar oldular. Axırda işlərinin üzərindən pərdənin qalxdığını gördükləri üçün naçar qalıb, hərəkəti davam etdirməyi qərara alaraq Təbrizə yönəldilər. Ələşkərd mənzilinə gəldikləri vaxt Diyarbəkrə hərəkət zamanı şaxtanın şiddəti ucbatından məiyyətdən ayrılmış olan Yaqub padşah tərəfdarlarından bəziləri Mənsur bəy Çəgəni ilə birlikdə ali orduya yetişdilər. Bu yurdda dövlət ərkanı və əmirlər əhd-peymanın əsasını təmtəraqlı andlarla möhkəmlədib bir-birindən tam arxayın oldular.

Bir neçə gün sonra xəbər gəldi ki, Sultan Xəlil, Yaqub padşahın müxalifliyindən və hərəkətindən agah olub sərsəm bir halda çoxlu ordu ilə Sultan bulağından Təbriz tərəfə sürətli yürüş etmişdir. Yaqub padşah bu xəbəri eşitdikdən sonra Süleyman bəyi Ömər bəy Cagirlü və İsgəndər bəy Piltən kimi bəzi əmirlərlə və ər yıxan cavanlardan beş min nəfərlə qabaqcadan yola saldı. Süleyman bəy ona verilmiş qoşunla Sarısudan təcili surətdə yola çıxıb, Sökmənabad yolundan şimşək və külək kimi keçərək Xoy çayı sahilinə yetişdi.

Yaqub padşah ətraf əmirlərə, sultanlara və hakimlərə cəlbedici məktublar (istimalətnamələr) göndərib hər kəsə layiqincə bol ənamlar və mükafatlar verəcəyini vəd etdi. Ərciş çayında dayandığı zaman yüksək məqamlı əmirlərdən bəziləri orduya qoşuldular. Həmçinin günbəgün adamlar ali taxtın ətəyinə üz qoydular. Beləliklə, böyük bir kütlə toplandı. Yaqub padşah ənam vermək üçün əlini açıb dirhəm və dinar saçmaqla kiçiklərin və böyüklərin könlünü ələ aldı. Bəndi-Mahidə dayandıqları zaman daha öncə adlarına cəlbedici məktublar yazılmış olan Qızıl Əhməd İsfəndiyar, Əmir Arslan və bir sıra digər əmirlər və sərdarlar [Sultan Yaqubun] ayağını öpməklə şərəfləndilər və növbənöv şəfqət və mərhəmətlə mümtaz qılındılar (üstün tutul-

[1325] Türkiyənin Siirt vilayətinin Baykan ilçəsində müsəlman övliyalarından Veys əl-Qəraniyə aid edilən məzar nəzərdə tutulur.
[1326] Türkiyənin Batman vilayətində ilçə mərkəzidir.
[1327] Bismilin şərqində Dəcləyə tökülən çay *(Öztürk, şərhlər, s.547)*.

dular). Bəndi-Mahi yurdu çox isti olduğundan ali bayraqlar Divcam[1328] yaylağına yola düşdülər. O məqamda elçi kimi Sultan Xəlilin hüzuruna getmiş Hacı bəy Mosullu büsatı öpmək izzəti ilə şərəfləndi. Abaqasaraya gəldikləri zaman şücaətinin çoxluğu, möminliyinin və comərdliyinin çeşidləri ilə seçkin və müstəsna olan böyük əmir Bəhram bəy Bayrami hüzura gəlmək şərəfinə nail oldu və hədsiz nəvaziş mərasimindən sonra hökmə əsasən mənqəlay əmirlərinə qoşuldu. O mənzildən yola düşdükləri vaxt Sultan Xəlilin Təbrizə gəldiyi və yükləri (ağruq) üçün Səhəndə getdiyi haqqında xəbər çatdı.

Yaqubun doğru görən rəyi belə qərara aldı ki, Bayandur bəy bir sıra əmirlərlə birlikdə mənqəlaya qoşulsun. Sonra oradan köç edib Sökmənabada gəldi. Əmir Həsən bəy Pornak büsatı öpmək izzəti ilə səadətə qovuşdu. Bu mənzildə [Yaqub padşah] mənqəlay əmirlərindən hər birini öz rütbələrinə layiq şəkildə dəyərli xələtlər, qılınc kəməri, bol nağd pullar, çoxlu qumaşlarla [mükafatlandıraraq onların] başını uca etdi. Bu mənzildə xəbər çatdı ki, Sultan Xəlil Yam[1329] keçidinə yetişmişdir. Ona görə də Yaqub padşah on iki fərsəx yol qət edib Xoy şəhərində mənqəlay əmirlərinə qoşuldu. O tərəfdən də Sultan Xəlil köç edib, Mərənddə dayanaraq Yaqub padşaha cürbəcür təhdidlər və hədələrdən ibarət olan, qoşunlarının say çoxluğundan və savaş ləvazimatlarının bolluğundan bəhs edən qəhredici bir məktub göndərdi.

Ertəsi gün Yaqub padşah Bayandur bəy, Qızıl Əhməd və Elaldı bəy Çepni kimi bəzi təcrübəli əmirləri döyüş məkanını təyin etməyə göndərdi. Sözügedən əmirlər təftişdən sonra belə qərar verdilər ki, əgər sultan Kərdəbişə[1330] yolundan hərəkət etsə, Xoy çayı körpüsünün ətrafını savaş məkanı etsinlər və əgər Pir Ömər Naxçıvani yolundan gələrsə, adı çəkilən pirin məzarının ətrafını döyüş mövqeyi etsinlər. Sonra düşməni yandıran bayraq ertəsi gün Xoy çayı körpüsündən keçib o ətrafda dayandı. Bu yurdda Kəmax xəzinəsi Maqsud bəylə birlikdə ali orduya qoşuldu. Xəbər çatdı ki, Sultan Xəlil Mərənddən köç edib. O saat ali əmr verildi ki, qalibiyyətli əsgərlər yüklərini (ağruq) qoyub döyüş üçün təyin edilmiş məkanda yerləşsinlər. O tərəfdən Sultan Xəlil Vələdian[1331] kəndindən köç edib döyüş və vuruş məkanına yönəldi. Sultanın vəziyyəti barədə həqiqət aydın olduqdan sonra qərara alındı ki, qələbə nişanlı əsgərlər dağın ətəyini tutub düşmənlərin qarşısında dayansınlar. Yurdçular hökmü yerinə yetirdilər. Əmirlərin hər biri müəyyən yerdə qərar tutdular.

Aləmi işıqlandıran günəş günortaya çatdıqda, iki tərəfin qaravulları bir-birinə yetişib döyüş alovunu alışdırdılar. Amma heç tərəfdən qətl baş vermədi. Əsr namazından[1332] sonra qaravulların yanından xəbər gəldi ki, sultan ata minib döyüş məkanına gəlmişdir. Dərhal ali hökm verildi ki, zəfər əlamətli qoşun da ata minib düşmənin üzərinə yollansın. Amma əksər əmirlərin məsləhəti bu idi ki, həmin günün axırlarında düşmənlə üzləşsinlər. Lakin bu fikrə qarşı çıxan Elaldı bəy Çepni ərz etdi ki, "bu vaxt ata minmək münasib deyildir; çünki sultan gec bir vaxtda döyüş mövqeyinə çatacaqdır və gecənin qaranlığı qoşunların qarşılaşmasına mane olacaqdır". Yaqub padşah bu fikri bəyənib əsgərlərin [atdan] enməsini əmr etdi.

Səhər vaxtı zər qanadlı, atəş dimdikli simurq (günəş) pərvaz etdi və onun heybətindən gecənin qarğası gündüz ölkəsinindən qaçdı.

Beyt

"Məşriqin ağ qartalına məğlub oldular,
Göydə rəngli tavus, yerdə qara qarğa qoşunu.
Əbu-Turab (Həzrət Əli) xanədanının nuru peyda oldu dağdan,
Gecənin Abbasilər dövləti alt-üst oldu"[1333].

O gün, sözügedən ilin [rəbiüləvvəl ayının] 14-də (15.06.1478) iki tərəf savaş niyyəti və ad-san təlaşı ilə bir-birinin qarşısında döyüş səfi çəkdilər. Yaqub padşahın sağ cinahı Süleyman bəy Bicənin[1334], Bəhram bəy Bayraminin, İsgəndər bəy Piltənin, Mahmud bəyin və digər əmirlərin və igidlərin vücudu ilə qüvvətləndi. Onun sol cinahı Bayandur bəyin, Həsən ağa Çələbioğlunun, Yusif bəy Təvaçının və Maqsud bəyin şücaət

[1328] Nuruosmaniyyə nüsxəsi: "Divcamə".
[1329] Mərəndə bağlı bir kənddir *(Öztürk, şərhlər, s.549).*
[1330] Xoyun bir kəndidir *(Öztürk, şərhlər, s.549).*
[1331] Xoyun kəndlərindəndir *(Öztürk, şərhlər, s.549).* Təsucun 40 mil şimal-qərbində yerləşir *(Seddon, şərhlər, s.296).*
[1332] Əsr namazı ikindi vaxtı qılınır.
[1333] Abbasilər sülaləsinin simvolu qara rəng idi. Ona görə də burada müəllif Abbasilər dövlətini gecənin qara rənginə işarə olaraq göstərmişdir.
[1334] Mənbədə bəzən Bicən, bəzən də Bijən şəklində yazılmışdır.

meydanına çevrildi. Mənqəlayda Ömər bəy Cagirlü, Mənsur bəy Çəgəni, Yusif bəy, Xurşid bəy və Cəmşid bəyin övladları kinli igidlərdən [ibarət] qələbəlik bir dəstə ilə qərar tutdular. O tərəfdən Sultan Xəlil də mərkəzi və cinahları tərtib edib sultanlıq döyüşünə üz qoydu. Hərbi kosun nərəsi və döyüş neyinin sədası dövr edən fələyə çatdı. Rəngarəng və növbənöv bayraqların əksindən və rövnəqindən, döyüş qalxanlarının parıltısından savaş meydanı gülzar və laləlik kimi görünürdü.

Beyt

“Qoşunun bayrağından yer Kəsranın qübbəsi kimi,
Əlvan bayraqdan hava bəzəkli kitab şəklində”.

O iki izdihamlı qoşun atəş püskürən iki dağ kimi savaş səhrasının səhnəsinə yollandılar və o iki təlatümlü dəniz kin meydanı sahəsində cuşa gəldilər. Hər iki tərəfin igidləri bir-birinə həmlə etdilər. Osman bəy Miranşahi, Şahəli bəy Pornak və Sufi Xəlil kimi adlı-sanlı əmirlərin təntənəsi və əzəməti ilə möhkəmlənmiş olan Sultan [Xəlilin] mənqəlayı irəli atıldı və onlar Sultan [Yaqubun] çərxçilərinə qarışaraq bir-birinin həyat damarını qopardılar. Yaqub padşahın mənqəlayı sultanın çərxçilərini geri oturdub onları qoşunun əsas hissəsinə çatdırdılar. Sultan öz ordusunun qəlbini (mərkəzini) top-tüfənglə möhkəmlətdiyi üçün Yaqub padşahın çərxçilərini pərişan etdilər.

Nəzm

“Yeddi qatlı göyün bu uca binası,
Tüfəng zərbəsindən fanilik libasına döndü.
Qılınc və tüfəngdən fitnə axtaranlar zəbun oldu,
Batində atəşə, zahirdə qana qərq oldu.
Adəti zülm etmək olan daş kimi ağır gürzdən,
Başlar aşağı düşüb ölüm yuxusuna getdi”.

Sultan Xəlilin mənqəlay əmirləri Uca Rəbbin köməyi ilə Yaqub padşahın çərxçilərini qovub onları muci əmirlərinə çatdırdılar. Yaqub padşahın muci əmirləri Şeyxəli bəy Möhürdarın oğlu Həsənəli bəy, Hüseyn bəy Qaqızmani, Seydi Əhməd bəy Pornak, Şah Məhəmməd Duxarlu və bəzi adlı-sanlı əmirlər idilər. Sultanın mənqəlay qoşunu say və qüvvə baxımından Yaqubun muci[1335] əmirlərindən üstün olduqları üçün onları da yerlərindən dəbərtdilər. Hüseyn bəy Qaqızmanini atdan salıb qılınc zərbəsi ilə yaraladılar.

Bu əsnada qızı sultanın hərəmi olan Söhrab bəy Çəmişkəzəki amansızlıq etməyi düşünüb, öz qoşunu ilə qılınclarını çəkərək Yaqub padşahın qoşununun arxasına keçdi, qətl etmək və çalışıb-vuruşmaq üçün əl qaldırdı. Amma bir iş görə bilmədi. Bu fürsətdə iki tərəfin igidləri bir-birinə qarışdılar. Mərkəz və cinahların əsgərləri üz-üzə gəldilər. O iki sərdarın iki tuğu yanaşı baş qaldırdı. Hər dəm hər iki mərkəz qoşunu bir-birinə qarışıb bir-birinin həyat damarını qoparırdılar. Çöl və biyaban öldürülmüşlərin qanından Bədəxşan ləlinin rəngini aldı. Döyüş meydanının torpağı bacarıqlı cavanların qanı ilə rəngləndi. Qanın nəmi balıqdan aya çatdı.

Nəzm

“Xəstə gözün suyundan balığa nəm çatdı,
Öldürülmüşün gözünün qanından buxar ucaldı.
Müxaliflərin ağzı alov ağzı kimi oldu,
Nizənin dişləri nar dənələri kimi [qızardı]”.

Rüstəmin və İsfəndiyarın “Həftxan” dastanındakı igidliklərinə[1336] həqarətlə baxan Sultan Xəlil igidlər dəstəsi ilə mərkəzin ortasına soxulub bir dəstəni həlak torpağı üzərinə saldı. Aslan yıxan hökmdar hansı igidlə qarşılaşırdısa, əgər dəmir dağ belə olsaydı, yenə də onu dağıdırdı.

Şeir

“Qılıncını döyüş meydanında qaldırdığı zaman,
Onun nəfəsindən yarılırdı Qaf dağı.

---

[1335] Muci / muçi – etimologiyası tam məlum olmasa da, qoşunun ön dəstələrindən birini ifadə etmək üçün işlədilən hərbi termindir.

[1336] “Həftxan” – Firdovsinin “Şahnamə” poemasının iki məşhur epizodunun başlığıdır. Bunlardan biri “Həftxani-Rüstəm”, digəri isə “Həftxani-İsfəndiyar” adlanır. Bu həftxanların hər birində Rüstəmin və İsfəndiyarın göstərdiyi yeddi qəhrəmanlıqdan bəhs edilir *(O.M.Davidson. Haft Kvan // Encyclopaedia Iranica, vol. XI, fasc. 5, New York, 2003, p.516-519).*

Üstünə kinlə cuman kimsəni,
Təzə-tər xiyar kimi iki yerə bölürdü".

Yaqub padşahın atının cilovunu bir tərəfdən Əli ağa Miraxur, digər tərəfdən də Övliya ağa tutmuşdu. Sultan qoşunun mənqəlayı olan Osman bəy Miranşahi qarşısındakıları yerlərindən dəbərdib, Yaqub padşahın ordugahına daxil olaraq Bayandur bəyin xanəsini ələ keçirdi və Məhdi-Ülyanın əlini öpmək şərəfinə nail olaraq, arxayınlıqla döyüş paltarını çıxarıb yemək hazırlamağa başladı. Sultanın Yusif bəy, Əli bəy Bayandur, Şibli bəy, Mahmud bəyin övladları Əli bəy və Hüseyn bəy kimi sol cinah sərkərdələri və başqa əmirlər və igidlər həmlə edib Yaqub padşahın sağ cinahını pərən-pərən saldılar. Ayaqlarını möhkəm tutub mərdlik göstərən Süleyman bəy və Şahəli bəy Bayraminin oğlu Bəhram bəy hər ikisi taleyin pəncəsində əsir oldular. Qəribə təsadüflərdəndir ki, həmin iki əmiri əlləri və boyunları bağlı halda sultanın bayrağının altına apardılar. Fələk elə bir lətifə ortaya çıxardı ki, Yaqub padşahın mərkəz qoşunu sultanın mərkəzini məğlub edərək onun yerində dayanmışdı. Onların tuğunu sultanın tuğu zənn edərək dustaq əmirləri oraya gətirdilər. Dərhal dustaq əmirlər xilas olub onları gətirmiş adamları dustaq etdilər[1337].

Xülasə, sultan qoşunu sağ cinahı yerindən dəbərdib mənqəlayı pərişan etdi. Sultan qalib gəldiyini təsəvvür edərək tam arxayınlaşdı. Sultanın mərkəz qoşununun əksər adamları qənimət ələ keçirmək və qaçanları təqib etmək üçün dağıldılar. Halbuki Yaqub padşahın mərkəz qoşunu dəmir dağ kimi yerində dayanmışdı. Sultan atını irəli çapdıqda onun gözü Yaqub padşahın mərkəz qoşununa düşdü və başından tüstü çıxdı. Əlacsız qalıb ətrafındakı adamlarla Yaqub padşahın mərkəz qoşununa həmlə edərək mərdliklə döyüşdü. Axırda Yaqub padşahın mərkəz qoşununun igidləri onun böyründən gəlib Sultan Xəlili əhatəyə aldılar. Şeyxəli bəy Möhürdarın övladları və Başlamış Əmiraxur öz övladları ilə onun üzərinə atılıb ardıcıl zərbələrlə onu yerə sərdilər (öldürdülər).

Fəth və zəfər doğduqdan sonra Yaqub padşah sultanın cəsədinin üstünə gəlib Allaha şükür etdi və öz ordugahına qayıtdı. Ertəsi gün köç edib duz mədənində (kani-nəmək) dayandı. Həmin gün böyük əmirlər büsatı öpmək izzəti ilə şərəflənib, canlarına aman əldə edərək ali bayrağın kölgəsində Vələdian kəndinə tərəf yola düşdülər. Oradan da Mərənd yoluna çıxıb, Təbrizə irəliləyərək xoşbəxt və uğurlu bir şəkildə Sahibabad mənzilini şərəfləndirdi. Savaşdan rahatlıq tapandan sonra sultanın əmirlərindən Məhmad bəy Alpavut və Qara Məlik Təvaçı qətlə yetirildilər. İlk həmlədə mərdanə səylər gösrərib qoşunun mənqəlayını yerindən dəbərtmiş Əmirzadə Osman Miranşahi taleyin üzünün onlara gülmədiyini gördükdə qaçmaq fürsətini qənimət bilib, bir neçə nəfərlə səadətli sultanın ordugahının yerləşdiyi Səhənd tərəfə getdi, adamlarını toplayıb bir guşəyə sığındı və öz əhvalını acizlik və yalvarış dili ilə ərz etdi. Padşahın lütfü onun günahlarının səhifəsi üzərindən əfv qələmi çəkdi. Hökm olundu ki, ümidvarlıq üzündən ali taxtın ətəyinə yollansın və yüksək mənsəblər əldə edərək hamıdan seçkin və möhtərəm olsun. Ona görə də Osman bəy büsatı öpmək izzəti ilə baş ucalığı qazanıb ənamlar və ehsanlarla nəvaziş gördü. Həmçinin sultanın digər əmirləri haqqında ehsan divanından əmin-amanlıq fərmanı hasil oldu. Onların hər biri sabiq mənsəblərinə [təyin edildilər] və layiq məvaciblərlə şərəfləndirildilər.

Sultanın [ölüm] xəbəri onun ordugahına çatdıqda, Əmirzadə Əli belə bir dəhşətə və heyrətə baxmayaraq, hökmdarlıq fikrinə düşüb, xəzinələrin nəfisliklərini götürərək öz anası ilə birlikdə İraq tərəfə yola düşdü. O zamanlar Həsən padşahın əmizadəsi olan Şeyx Həsən bəyin oğlu Hacı bəy rumilərlə savaşda göstərdiyi mərdliyin mükafatı olaraq İsfahan hakimliyinə yüksəldilmişdi. Lakin sultan divanından İraq vəzirliyini almış Şah İmadəddin Salman Deyləmi[1338] özünün mali və mülki bacarığı üzündən İsfahan işlərinə o dərəcədə müdaxilə edirdi ki, hakimliyin quru adından savayı Hacı bəyə heç nə qoymurdu. Buna görə də o, İsfahandan çıxıb sultanın hüzuruna yola düşmüşdü. O, sultanın qətli, Yaqub padşahın qələbəsi və sultanın oğlu Əmirzadə Əlinin gəlişi xəbərini Kaşanda eşitdikdə çox xoşhal oldu.

Qafil bir uşaq olan Əmirzadə Əli qabiliyyətsiz lələsi, pərişan adamları və uğursuz taleyi ilə tədricən İraqa doğru məsafələri qət edərək gedərkən, bir gecə köç əsnasında Əmir Hacı bəy Duxarluya rast gəldi və bir-birinin üstünə qılınc çəkdilər. Axırda Əmirzadə Əli məğlub olub Qəzvin tərəfə üz qoydu. Onun anası və

[1337] Paris nüsxəsi: "Dərhal onları qətlə yetirib dustaqları azad etdilər".
[1338] Paris nüsxəsi: "İmad ibn Süleyman Deyləmi".

xəzinələri düşmənin əlinə düşdü. Əmir Hacı bəy onun qoşunun əmirlərini və sərdarlarını bağlayıb İsfahana yönəldi.

Şəhərin ətrafına çatdığı zaman vəzir onu qarşılamaq üçün şəhərdən çıxdı. Onlardan hər biri bir-birinə qəsd etmək üçün hazırlıq görürdü. Bir neçə gün batində düşmənlik, zahirdə dostluq etdilər. Sonra Əmir Hacı bəy Təbərrük[1339] qalasını zəbt etməklə məşğul oldu və özü ailəsi ilə birlikdə qalaya köçdü. Bir gün ata minmiş halda vəzirlə birlikdə qala darvazasından keçdi. Öz oğlu Əmir Şeyx Həsənlə qərarlaşdırdığı şəkildə əmirzadə (Əmir Şeyx Həsən) [qaladan] aşağı enib, qonaqpərvərlik göstərərək onları qalaya daxil etdi. [Əmir Hacı bəy] dərhal vəziri dustaq edib bir neçə gün sonra qətlə yetirdi və İraq mülkünün sadəcə özünə məxsus olacağını zənn etdi.

Şirazda da bəziləri Əmirzadə Əlvənd tərəfindən oraya göndərilmiş və bəziləri isə daha əvvəllər Farsın və ətrafın mühafizəsinə təyin edilmiş olan bir sıra böyük əmirlər Əmirzadə Əlvəndin səltənəti üçün ittifaq bağladılar. Onlar zahirdə Yaqub padşaha itaət və tabeçilik göstərsələr də, gizlində qərara aldılar ki, əgər Yaqub padşah sadəcə öz adına sikkə və xütbə icra etməklə kifayətlənsə, onlar da itaət və tabeçilik göstərməkdə səhlənkarlıq etməyəcəklər; və əgər o, Fars vilayətini ələ keçirmək istəsə, ona qarşı müdafiə və müqavimət məqamında dayanıb səy göstərəcəklər və Əmirzadə Əlvəndi padşah adlandırıb, bir dəqiqə belə olsun, onu himayə etməkdən əl çəkməyəcəklər.

Sözügedən hadisələr Yaqub padşahın qulağına çatdıqda qərara aldı ki, Bayandur bəy İraqa yollanıb o tərəfdə yüksəlmiş fitnə-fəsad atəşini pəhləvancasına mübarizə qılıncının suyu ilə söndürsün. Bayandur bəy əmrə uyğun olaraq İsfahan ətrafına çatdıqda, Hacı bəyin qiyamçılıq alovunu cəlbedici sözlərin suyu ilə yatırmaq istədi. Hacı bəy tədbir yolu ilə Bayandur bəyi cəza bəndinə salmağı düşündü. Bayandur bəy də həmin xəyalla onunla görüşə gəldi. İsfahana yetişən gün o, qoşununu döyüş nizamına salıb uzun bir səf çəkdi. Hacı bəy qarşılamağa gəldiyi vaxt onu ov kimi dövrəyə alıb həbs etdilər və şəhərə daxil oldular. Ondan sonra Bayandur bəy səy və tədbirlə bütün İraqı ələ keçirdi.

Əmirzadə Əlvənd Şirazdan Yaqub padşahın taxtının ətəyinə elçilər və töhfələr yollayıb itaət və tabeçilik izhar etdi və sikkə göndərdi. Ərz etdi ki, "mərhum atam Farsı bu bəndəyə vermişdi və əgər kama çatmış əmim həzrətləri də həmin qaydada [oranı mənə] lütf edərlərsə, bu bəndəyə nəvaziş göstərmiş olar". Yaqub padşahın əmrinə əsasən, Şiraz hakimliyinin fərmanını qardaşı oğlunun adına yazıb göndərdilər və Fars əmirlərinin istəyinin ziddinə olaraq, Şəbankərə mülkünü ali divanın mülkiyyətinə daxil etdilər. Bayandur bəyin geri çağırılması haqqında ali hökm verildi. Bayandur bəy də İsfahan daruğalığını öz qohumu Habil bəyə verib darüssəltənə Təbrizə yönəldi. İraqda baş vermiş əksər fitnələrin mənşəyinin İsfahan sərdarları olduğu haqqında fikir çox yayıldığı üçün o, [oranın] bütün adlı-sanlı böyüklərini özü ilə Azərbaycana gətirdi. Hüseynəli bəy Həmzəhacılu, Əbu-Bəkr bəy Bektaş, Hüseyn bəy Hacılu, Əmirzadə Qəzənfər bəy Miranşahi, Hacı bəy Alpavut, Piri bəy və Bəhram bəy Bayandur kimi Şiraz əmirləri ali taxtın ətəyinə ərizələr göndərib, acizlik və yazıqlıq izhar edərək Fars mülkünün daruğalarının təyin olunmasını xahiş etdilər və həmin məmləkət tamamilə məmaliki-məhrusəyə (mühafizə altındakı məmləkətlərə) daxil oldu.

### Ölümlər

Əmir Seyid Əsiləddin[1340] hədis elmində əvəzsiz idi. Bu il, rəbiülaxır [ayının] 17-də (18.07.1478) əbədi aləmə yollandı. Əsərlərindən insanların ən xeyirlisi olan həzrətin (Məhəmməd peyğəmbərin) mədhi barəsində "Dürci-dürər" ("İncilər qutusu") adlı kitabı vardır.

## 884-CÜ İLDƏ (25.03.1479 – 12.03.1480) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Rum padşahı Sultan Məhəmmədin Arnavut İsgəndəriyyəsinə qoşun çəkməsi

Bu il Rum padşahı Sultan Məhəmməd hərəkət bayrağını İsgəndəriyyə[1341] diyarına tərəf qaldırdı. O, Əhməd paşanı Rumeli ordusu ilə həmin hadisənin aradan qaldırılması üçün təyin etdi. Gədük Əhməd paşa

---

[1339] Təbərrük – İsfahanda qala.

[1340] O, Sultan Əbu-Səid zamanında öz vətəni olan Şirazdan Herata getmişdi və orada həftədə bir dəfə Gövhərşad bəyim mədrəsəsində moizə oxuyardı *(Nəvai, şərhlər, s.822)*.

özünü qorumaq üçün ordunun sərkərdəliyini qəbul etmədiyinə görə sultanın hökmü ilə İstanbulun Yeniqalasında[1342] həbsə salındı.

Sultan o qalanın alınması üçün bir dəstə təyin etdi. Onlar əvvəlcə Ağcahisarı[1343] mühasirəyə aldılar. O qalanın camaatı müqavimətsiz və vuruşmasız qalanı sultanın mülazimlərinə təslim etdi. Sultan oradan ordunun bir qismini İsgəndəriyyəni almağa göndərdi. O qala hündür bir dağın üstündə yerləşən əzəmətli bir qaladır. Nə sürətlə uçan şahin onun üzərindən keçə bilər, nə də dibində duran [adamın] gözünün nuru onun şərəfələrini görə bilər.

Şeir

“Simurq özünü onun ətəyindən aşağıda gördü,
Digər otuz quş da özünü orada gördü.
Halbuki hər biri yüz il yuxarı uçmuşdu,
Hər biri bir Qaf dağını ağzında tutmuşdu”.

O qalanın bir tərəfindən əzəmətli Tuna çayı axır[1344]. O elə bir çaydır ki, Dəclə və Fərat onun yanında bulaq (çeşmə) kimi görünür. Onun böyründəki keçid isə təqvim cədvəli kimi [dardır].

Nəzm

“Onun suyu ilə müqayisə ediləcək su yoxdur,
Fərat və Dəclə onun yanında ilğım kimidir.
Günəşin çeşməsi nurla dolu olduğu kimi,
Bu adı çəkilən çay da saf və pak su ilə doludur”.

Bu qalanın üç tərəfində daha üç qala tikmişlər. O qalalardan biri Leş, biri Dərğus və biri Gölbaşı adlanır[1345].

Dərğus qalasının dağı və çölü büsbütün zeytun ağacları ilə doludur. Qala mühafizlərinin yaşayış mənbəyi o ətrafın məhsullarına bağlıdır. Amma Gölbaşı qalasını bir gölün ağzında tikmişlər. Bu qala vasitəsilə o gölün məhsullarını və mənfəətlərini ələ keçirmişlər. Belə ki, hər il o gölün balıq gəliri qırx min qırmızı firəngi təşkil edir. Leş qalası isə biri Yunaniyyə və biri Dirine adlanan iki böyük çayın bir-birinə qovuşduğu yerdədir. Həmin yerdən keçdikdən sonra bu çay son dərəcə qüvvətli və dərin bir şəkildə Firəng (Adriatik) dənizinə tökülür. İsgəndəriyyəni adı çəkilən çayların dənizə töküldüyü yerdə bina etmişlər. Məhsulu və gəliri çox bol olan bir məmləkəti o qalaya tabe etmişlər. Qədim zamanlarda bu qalalar və məmləkət Arnavut ölkəsinə daxil olsa da, o çayların orada dənizlə birləşməsi üzündən Firəng və Venedik padşahları o məmləkəti yaxşı bir tədbirlə ələ keçirmiş, oranın qalalarını dəniz yolu ilə [gətirdikləri] hər növ silahlarla qüvvətləndirib möhkəmlətmişdilər.

Sultan ucsuz-bucaqsız bir ordu ilə İsgəndəriyyə qalasını mühasirəyə aldı. O diyarın yollarından keçmək çətin olduğu üçün sultan bir neçə min batman misi əsgərlər arasında bölüşdürdü. Onlar misi qalanın ətəyində olan topçulara verdilər. Topçular toplar (qazğanlar) töküb qalanı topa tutdular. Qalanın bürcünü və divarını xırda kütlələr, incə hissəciklər və kiçik zərrələr kimi toz halında ələyib tökdülər.

Sultanın hökmünə əsasən, müzəffər mücahidlər bir anda İsgəndəriyyə qalasını fəth etməyə üz tutdular. Hər kəs o möhkəm qalaya dırmanmağın fikrini çəkməyə və tədbirini görməyə başladı. Kəndirdən nərdivanları və ipdən kəməndləri dağın ətrafına və belinə atıb qala hasarının ayağına çatdılar. Amma top zərbələrindən rəvan qum kimi hər tərəfə yığın-yığın tökülmüş divar daşları ucbatından heç bir keçiddən [qalaya] çıxmaq üçün yol tapa bilmədilər. Çünki dağılmış daş və kərpic parçaları üzərinə ayaq qoyan hər kəs yüksəklikdən ixtiyarsız olaraq aşağıya yuvarlanırdı. Üstəlik, qalanın üzərindən də atəş təbiətli (qızğın) kafirlər oxla, daşla, neftlə və tüstü ilə qalanı almaq istəyən cavanların bir qismini həlak torpağı üzərinə sərdilər. Min cür tədbirlə qalanın ayağına çatmış olan igidlərdən hər kəsi əl zərbəsi ilə aşağı saldılar. O gün səhərin açılmasın-

[1341] Albaniyanın İskodra (İşkodra) şəhəri nəzərdə tutulur. Həmin vaxt ora venesiyalıların nəzarəti altında idi *(Nəvai, şərhlər, s.823).*
[1342] Rumeli Hisarı nəzərdə tutulur *(Öztürk, şərhlər, s.556).*
[1343] Ağcahisar (albanca: Kruje) – Albaniyanın mərkəzi hissəsində qəsəbə.
[1344] Burada bir yanlışlıq var. Dunay çayı Albaniyadan axmır.
[1345] Digər adları ilə Leş – Alessio və ya Lisus, Dərğus – Drivasto, Gölbaşı isə Zablcak adlanır *(Öztürk, şərhlər, s.556).*

dan axşamın zülmətinin çökməsinə qədər rumilər dəfələrlə dəstə-dəstə igidlik göstərdilər və hər tərəfdə bir çoxları həlak torpağı üzərinə düşdülər.

Sultana aydın oldu ki, mücahid əsgərlərin səy və cidd-cəhd göstərmək baxımından heç bir təqsiri olmasa da, o qalanı yürüşlə və döyüşlə almaq mümkün deyil. Hər an əlahəzrət sultanın könlü fəth və zəfərin yubanması ucbatından mütəəssir idi və bu işin həll edilməsi və əncamının çəkilməsi baxımından çox fikrə qapılmışdı. Dövlət ərkanı ilə məşvərətlər zamanı belə məsləhət gördülər ki, İsgəndəriyyə ətrafındakı üç qalanı da eyni zamanda mühasirəyə alsınlar və Allah-taalanın köməyi ilə o qalalar zəbt edildikdən sonra İsgəndəriyyə qalası da tədricən fəth edilsin. Ona görə də Rumeli əmirülümərası Davud paşanın ona tabe olan əmirlər və əsgərlərlə birlikdə Gölbaşı üzərində fəth bayrağını qaldırmasına, Anadolu bəylərbəyisi Süleyman paşanın da o tərəfin əmirləri və əsgərləri ilə birlikdə Dərğus qalasını mühasirə etməsinə qərar verildi. Təsadüfən, Davud paşa Gölbaşı qalasına çatdıqda kafirlər qalanı müqavimətsiz təslim etdilər. Fəth xəbəri sultana yetişdiyi zaman o, Davud paşanın da Dərğus qalasına getməsini əmr etdi.

Adı çəkilən qalanı Davud paşa və Süleyman paşa bir neçə gün mühasirə etdikləri üçün qala camaatını hər cəhətdən təngə gətirdilər. Bir gün Davud paşa qoşunu yağmaya və taraca səsləyərək qalaya hücuma keçdi. İgidlər həmin gün belə bir möhkəm qalanı ələ keçirdilər. O qala da alındıqdan sonra sultan hökm verdi ki, həmin qoşunlar o qaladan çıxıb Leş qalası üzərinə getsinlər və birlikdə o qalanı necə olursa olsun fəth etsinlər. Leş qalası mühafizləri əvvəlki iki qalanın fəthində islam ordusunun göstərdiyi qüdrəti eşitdikləri üçün qorxularından qalanın müdafiəsindən əl çəkdilər. Həmin əzəmətli çay vasitəsilə Firəngistandan qalanın ətəyinə bir neçə böyük gəmi gəlmişdi. Qala əhlinin hamısı öz arvad-uşaqları və malları ilə birlikdə gəmilərə oturub özlərini o çaydan dəniz sahilinə çatdırmaq və ailələri ilə bərabər mücahidlər qoşununun arasından çıxıb fəlakətdən qurtulmaq istədilər. Gəmilərin böyük çaydan keçiş yeri sultan ordugahının qarşısından idi. Ona görə də sultan düşərgəsində olanlar çayın qarşı tərəfindən gəmilərin gəlməsindən dərhal xəbərdar oldular. Sultan ordusunun qaziləri və qənimətçiləri arasında böyük bir gurultu qopdu və onlar qalxıb çayın kənarına qaçdılar. İgid dalğıclardan və cəsur üzgüçülərdən hər biri özlərini çılpaq qılınc kimi üryan edib, qılınclarını dişlərində tutaraq kafirlərə yönəldilər və gəmiləri tutdular. Bəziləri can qorxusundan özlərini quruya atdılar. Rum ordusu çayı adlayıb hamısını əsir aldı. Sultan fərman verdi ki, Rumeli və Anadolu əmirlərinin və əsgərlərinin əksəri İsgəndəriyyə qalasının ətrafında dayanaraq firənglərin qurudan və sudan gəliş-gediş yolunu bağlasınlar. Əzəmətli Yunaniyyə çayının iki tərəfində iki qala tikib orada bir dəstə [əsgər] qoydular və sultan dönüş bayrağını qaldırdı.

Mühasirə müddəti altı ay davam etdiyinə görə kafirlər qalanın üstündən bağırdılar:

- Rica edirik, Venedik padşahına xahişimizin çatdırılması üçün bir nəfərə yol verəsiniz ki, o, ya qoşun göndərsin, ya da qalanı təslim edirik.

Əhməd bəy qala camaatına yol verdi. Yardım gəlməyəcəyi məlum olduqdan sonra onlar qalanı təslim etdilər. Yükləmək və nəql etmək (evakuasiya) üçün Firəngdən beş gəmi göndərdilər. Onlar minib Venedikə yollandılar. Əhməd bəy yeniçərilər və əzəblər dəstəsini orada qoyub sultanın dərgahına yönəldi.

Həmçinin bu il Rum padşahı Sultan Məhəmməd Azaq dənizi sahilində yerləşən Tuna (Don) qalasını fəth etmək üçün qoşun göndərdi. O diyarın kafirləri müqavimət göstərmədən qalanı təslim etdilər.

Həmçinin bu il mübariz sultan, Sinan bəyi çoxlu qoşunla Bayburtun yaxınlığında olan Torul qalasını almağa göndərdi. Oranın keçmiş hakimi yüz min hiylə ilə Rum padşahının əlindən xilas olub özünü Həsən padşahın hüzuruna çatdırdı[1346]. Rumilər o diyarı ələ keçirdilər.

### Xorasan diyarında baş vermiş hadisələr və Sultan Əbu-Səidin oğlu Mirzə Əbu-Bəkrin Sultan Hüseyn mirzəyə qarşı müxaliflik etməsi haqqında söhbət

Bu il Mirzə Əbu-Bəkr böyük qoşunla Bədəxşan dağlarından Xorasana gəldi. Bu xəbər Sultan Hüseyn mirzəyə çatdıqda o, Əmir Əhməd Firuzşahın oğlu Əmir Əbdülxaliqi min nəfər təcrübəli döyüşçü ilə birlikdə onu dəf etməyə göndərdi. Mirzə Əbu-Bəkr məğlub olub Bəlx tərəfə qaçdı və oradan da Sistana tələsdi. Sistandan Əlişəkərin oğlu Pirəli ilə birlikdə Kirmana yönəldi. Orada fəlakətə düçar olmuş Qaraqoyunlular-

[1346] Burada xronoloji uyğunsuzluq vardır. Çünki Həsən padşah həmin tarixdə həyatda deyildi *(Nəvai, şərhlər, s.828).*

dan və yolunu azmış adamlardan [ibarət] bir dəstə ilə yola çıxdılar. Bəziləri fəth və xoşbəxtlik ümidi, bəziləri isə soyğun və qarət arzusu ilə onun yanına toplanmışdılar. Kirman valisi olan Əlixan bəy Cahangir oğlu qaçış yolunu tutub İraqa yollandı. Əlixan bəyin getməsindən sonra Sircan və Kirman məmləkəti cağatay və türkman qoşununun əlinə keçdi.

O azğın tayfanın istilaçılıq xəbəri Yaqub padşaha çatdıqda o, Bayandur bəyi və Sufi Xəlil Bektaşı qəti bir şəkildə o quldur dəstəsini dəf etməyə göndərdi. Mirzə Əbu-Bəkr və Əlişəkər oğlu Əmir Pirəli o orduya qarşı müqavimət göstərməyin və mübarizə aparmağın öz imkanları daxilində olmadığını gördülər. Onlar öz adamlarını Sircan qalasında qoyub Sistan tərəfə qaçdılar. Əmirlər qalanı tutub Təbrizə qayıtdılar.

Mirzə Əbu-Bəkr Xorasan vilayətinin hüduduna çatdıqda, Sultan Hüseyn mirzənin niqris (podaqra) xəstəliyinə tutulduğunu eşidərək Bayram bəy, Əmir Pirəli Türkman və b. əmirlər və əsgərlərlə Herata yönəldi. Xəyalı bu idi ki, Sultan Hüseyn mirzəni qəflətən ələ keçirsin. Sultan Hüseyn mirzə, Əbu-Bəkrin boş xəyalından xəbər tutduqda, xəstəliyinin şiddətinə baxmayaraq, kəcavəyə oturub beş yüz süvari ilə İsfizar qalasına yönəldi.

Bu əsnada Can Əhməd Çuli bir gecə Mirzə Əbu-Bəkrin qaravulları ilə qarşılaşdı. Onu tutub şahzadənin yanına apardılar. O cənab (Mirzə Əbu-Bəkr), Sultan Hüseyn mirzənin əhvalını soruşanda o (Can Əhməd Çuli) cavab verdi:

- O həzrət bu günlərdə sizin gəlişiniz barədə xəbər alıb on beş min nəfərlə Herat ətrafında pusquda durmuşdur ki, sizin bu hüduda gələcəyiniz təqdirdə hücum edib qələbə çalsın. Bu bəndənin üzərində Sultan Əbu-Səid mirzənin haqqı çox olduğu üçün şəhərdən qaçıb sizin hüzurunuza gəldim ki, düşmənlərinizin vəziyyətini söyləyim.

Mirzə Əbu-Bəkr bu xəbərin həqiqətəuyğun olduğunu təsəvvür edib, Herata getməkdən əl çəkərək Xəvaf və Baxərz tərəfə üz qoydu. Əhməd Çuli geri dönüb, Sultan Hüseyn mirzənin hüzuruna gələrək əhvalatı ona danışdı.

Sultan Hüseyn mirzə bir dəstə ilə onun üstünə sürətli yürüş etdi. Mirzə Əbu-Bəkr Astarabada üz qoydu. Hər mənzilbaşında ordusundan bir dəstə ondan üz döndərib Sultan Hüseyn mirzəyə qoşulurdu. Zəfər nişanlı ordunun ön dəstəsi Gürgan çayı[1347] sahilində ona çatdı. Mirzə Əbu-Bəkr can qorxusundan Dehistana tələsib oranın kələntərlərindən birinin evində yerləşdi. Özünü bəla girdabından nicat sahilinə çatdırmaq üçün bir at istədi. Həmin şəxs razılaşdı. Amma eyni zamanda onun yanında bir dəstə adamını qoyaraq o saat ali taxtın ətəyinə yollandı və əhvalatı ərz etdi. Sultan Hüseyn mirzə, Qənbər Əli Cəlairi Mirzə Əbu-Bəkri tutmağa göndərdi və o, mirzəni ələ keçirib qətlə yetirdi. Mirzə Əbu-Bəkrə öz evində yer vermiş və xəyanət yolunu tutmuş o dehistanlını da qətlə yetirdilər.

## Müxtəlif əhvalatlar

Bu il Məhəmməd padşah Qaresi eli[1348] ətrafında yerləşən, biri Sucam adası və digəri Sürcə adası kimi tanınan adaları abadlaşdırdı. Çünki [həmin adalar] pozğun kafirlərin şərindən və zülmündən "O yurdun altını üstünə çevirdik"[1349] vəziyyətinə düşmüş, onların sakinləri və camaatı kafirlərin əli və əzab-əziyyətin ayağı altında qalaraq pərən-pərən olmuşdular. Ona görə də [bu adalar] abadlaşdırıldı. Padzəhr gili (tini-məxdum) buradan hasil edilir. Həmin adaların şəraiti üzündən iki yüz il idi ki, padzəhr gili ələ düşmürdü və onun əvəzinə erməni gili (tini-erməni) istifadə olunurdu. Sultan həkimləri (alimləri) göndərdi və onlar padzəhr gilini aşkarlayıb, mədəndən çıxararaq sultanın hüzuruna gətirdilər.

---

[1347] Gürgan çayı İranın şimal ərazisindədir və Xəzər dənizinin cənub-şərqinə axıb tökülür. Ətrək çayı öz mənbəyini Kopetdağ silsiləsindən götürür və İran-Türkmənistan sərhədində Xəzər dənizinə tökülür.

[1348] Qaresi eli – XIII əsrin sonları – XIV əsrin ilk yarısında Anadolunun şimal-qərbində yerləşən və mərkəzi Balıkəsir olan bəylik. Qaresi eli, Osmanlı tərkibinə qatıldıqdan sonra sancaq adı kimi saxlanılmışdır *(Z.G.Öden. Karesioğulları // TDVİA, cilt: 24, yıl: 2001, s.488-489).*

[1349] *Qurani-Kərim, "Hud" surəsi, 82-ci ayə.*

Həmçinin bu il Rum padşahı Sultan Məhəmməd, Gədük Əhməd paşanı həbsdən çıxarıb Boliyanı[1350] fəth etməyə və orada hakimiyyət sürməyə göndərdi. Əhməd paşa Boliyanı və oranın qalalarını alıb, çoxlu mallar ələ keçirərək o diyarda yerləşdi.

## 885-Cİ İLDƏ (13.03.1480 – 01.03.1481) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Rum padşahı Sultan Məhımmədin Məsih paşanı Rodos adasını ələ keçirməyə göndərməsi

Bu il Rum padşahı Sultan Məhəmməd ikinci vəzir Məsih paşanı üç min yeniçəri, dörd min əzəb, bütün Anadolu ordusu və top-tüfənglə dolu altmış böyük gəmi ilə Aydın eli civarına yaxın olan Rodos adasını ələ keçirməyə göndərdi. O, elə bir əzəmətli qala idi ki, ayağı və başı yerin nəm çəkmiş dibindən Sürəyyaya qədər çatırdı. Xəndəyinin dibi və küngürəsinin ucu balıqdan aya kimi uzanırdı. Onun fəthnaməsini nə gözətçiləri görmüş, nə də [ətrafdakı] dağların zirvəsi şahid olmuşdu.

Şeir

“Möhkəmlikdə fələk belə onun kimi deyildir,
İsgəndər səddi idi onun divarı.
Onun binasındakı hər daş bir dağ idi,
Hündürlükdə Zühəlin damından yüksək idi.
Yüksəklik baxımından o binanın hər divarı,
Heç şübhəsiz ki, bir-biri ilə yarışırdı”.

Məsih paşa məsafələri adladıqdan sonra qurudan və dənizdən adı çəkilən qalanı mühasirəyə alıb Ərəb bürcünə[1351] hücum etdi. Gəmilər həmin bürcün ayağına çatanda su [yolu] dar olduğuna görə hərəkət edə bilmədilər. Ona görə də Məsih paşa burada bir körpü tikdirdi. Sonra yenidən dənizdən və qurudan hücuma keçdilər. Çoxsaylı bir dəstə gəmilərin arasından özlərini suya atıb üzərək Ərəb bürcünə çatdılar. Körpü uçduğu üçün körpünün üstündə dayanan adamlar bir anda suya düşdülər. Belə ki, üç min sarıq və külah (papaq) köpüklər kimi suyun üzünə qalxdılar. Firənglər cəsarətlənərək ox və tüfəng zərbəsi ilə çılpaq adamları həlak etdilər.

Bu məğlubiyyətə baxmayaraq, Məsih paşa ertəsi gün hücuma keçdi. İki tərəfdən küfr və islam əhli top və tüfəng mərmilərini yağış damlaları kimi yağdırmağa başladılar. Mücahidlərin hədəfə dəyən oxları əcəl qartalları kimi din düşmənlərinin göz yuvalarına qonmağa başladı. Mücahid igidlər mükəmməl bir səy və cəhdlə sinələrini bəlalı ox yağışı önündə sipər etdilər və güclü əlləri ilə mərdlik göstərərək tədbir kəməndini qala və hasar bürclərinin şərəfələrinə atdılar. Allahın köməyi ilə hasarın bir yerində yeddi ədəd islam bayrağını kafirlərin divarının küngürəsinə sancdılar. Qalanın bir tərəfində geniş bir yarıq açıb qalanın içini almaq üçün tam səy göstərdilər. Qayda belə idi ki, şəhər və qala qazilər tərəfindən fəth edildiyi təqdirdə yağmalanırdı və vəd edilmişdi ki, tarac yolu ilə əldə edilmiş qənimətlər qarətçilərin özlərinə qalacaqdır. O şəhərin və qalanın mallarının və sərvətinin bolluğu zəmanə əhli arasında məşhur olduğu üçün qazilərdən və mücahidlərdən hər biri o qalanın mallarını və qənimətlərini ələ keçirmək üçün sözlə ifadə edilməyəcək dərəcədə səy göstərdilər. Qəzavat və cihad sahiblərinin o cəhdlərinin nəticəsində həmin yeddi sancaq (bayraq) qalanın içinə daxil oldu. Amma ordu sipəhsaları (komandanı) Məsih paşa o bayraqların içəri daxil olması ilə fəthin nişanələrini və əlamətlərini müşahidə etdikdə, döyüş əsnasında çığırdı ki, “şəhərin içi sultanın xassə mülkiyyətinə məxsus olacağı üçün [oranı] yağmalamaq qadağandır və əsgərlərin sərbəst şəkildə soyğun və qarət etmələri barədə verilmiş vəd ləğv olunur”. Buna görə də bu xəbərin yayılması üzündən tamah sahiblərinin ümidi qırıldı. Hələ qalanın xaricində olan və canlarını fəda edib içəri girmək üçün nərdivanlarla qala bürclərinə çıxmağa çalışan əsgərlərin bir hissəsi can-başla vuruşmaqdan əl çəkdilər. Yaramaz kafirlər bir anda top-tüfəng və rəngarəng silahların zərbələri ilə islam bayraqlarının və qazilər ordusunun daha öncə [qalaya] girdikləri yarıqdan onları geri oturtdular. Öncədən [qalanın içinə] getmiş olan mücahidlər dəstəsi ümid edib gözləyirdi ki, onların ardınca başqa əsgərlər də şəhər-qalanın içinə daxil olacaqlar və onların ardınca mərdanəlik bazu-

[1350] İtaliyanın Adriatik dənizi sahilindəki Poliya (Pugliya) bölgəsi nəzərdə tutulur *(Nəvai, şərhlər, s.830).* Bu yürüş zamanı, 1480-ci ilin avqust ayında həmin bölgədəki Otranto şəhəri alınmışdı. 885-ci il hadisələri içində də bu əhvalat xatırlanır.
[1351] Avropalılar bu bürcə Saint-Nikolas deyirdilər *(Nəvai, şərhlər, s.831).*

sunun qüvvəti ilə başqa yerlərdən də yarıqlar açacaqlar. Amma yağmanın və taracın qadağan olunduğunun səs-sədası ucbatından, bir-birinin ardınca irəliləyən əsgərlər ayaqlarını irəli atmaqdan çəkindilər. Şəhərin içinə daxil olmuş dəstə isə islam qoşununun onlara dəstək və kömək olmaq üçün gəlmədiyini gördükdə, sürəkli olaraq kafirlər qoşununun hücumunun şiddətindən və atəş saçan topların və tüfənglərin zərbələrindən məğlubiyyətə uğradılar və girdikləri yarıqdan geri çəkilmək üçün tələsdilər. Lakin çıxış yolunun kafirlərin qılınc və xəncərləri ilə bağlı olduğunu gördükdə imkanları daxilində kafirlərə qarşı cihadda canü-dildən səy göstərdilər. Nəticədə, əksəriyyəti şəhidlik dərəcəsinə çatdılar. Başqa əsgərlər də ümidsiz və qolu-qanadı sınmış halda döyüş məkanından geri çəkildilər. Əvvəllər Anadolu əmirülümərası olmuş və həmin zaman Kastamonu hakimi olan Süleyman paşa o dəhşətli savaşda qətlə yetirildi. Böyük sərkərdələrdən və adlı-sanlı döyüşçülərdən bir çoxu həmin zaman din düşmənlərinin əlinə keçdi və öldürüldü. Zərurət üzündən Məsih paşa vəziyyətin nə yerdə olduğunu ali taxtın ətəyinə ərz etdi. Ondan sonra qoşundan heç kimsə savaş təklif etmədi. Axırda [sultandan Məsih paşaya] qarşısında cahanın müti olduğu belə bir hökm gəldi: "O diyarın fəthi müyəssər olmadığı üçün islam qoşununu götürüb Rodosun qarşısında, Aydın eli [adı] ilə tanınan dəniz sahilində yerləşən Mutorum (Bodrum)[1352] adlı qalanın üzərinə apar! O qalanın camaatı həmişə islam əhlinə böyük zərər vurur. Həmin qoşunla o qalanı ələ keçir və oranı fəth etdikdən sonra yubanmadan ali taxtın ətəyinə gəl!"

İtaət olunması vacib əmrə uyğun olaraq, o çox hündür qalanın fəthi üçün hərçənd top-tüfəng zərbəsi və hücumla cəhd edilsə də, fəth qapıları heç vəchlə onun səylərinin üzünə açılmadı. Əhvalatın təfsilatı cahcalallı [sultanın] qulağına çatdıqdan sonra hökmdar hökm etdi ki, Məsih paşa islam qoşununu o səfərin yorğunluğundan və məşəqqətindən azad edib buraxsın və hərəkət yüyənini o tərəfdən döndərsin. Hökmə uyğun olaraq, Məsih paşa gəmiyə oturub darülxilafət (xilafət mərkəzi) İstanbula yolandı. O, hələ gəmidə ikən ona sultanın belə bir hökmü çatdırıldı: "Onu vəzirlikdən azad edirəm və Gelibolu hakimi təyin edirəm. Gərək yoldan dönüb təyin edildiyi yerə getsin və gəmi xidmətləri məşğul olsun"[1353].

### Sözügedən ildə türkman ordusunun Misir və Şam qoşunları ilə müharibə etməsi və Başbəyin öldürülməsi

Bu il adını Başbəy qoymuş Baliş bəy Dəvatdarın başına Əcəm bölgələrini fəth etmək sevdası düşdü. O, Sultan Qayltbayın fərmanı ilə bütün Misir, Şam, Hələb və ərəb əsgərlərini toplayıb, təqribən qırx min süvari və piyada ilə Fərat çayını keçərək Ruha (Urfa) qalasını əhatəyə aldı. O diyarın hakimi Əmirzadə Bektaş, Başbəyin qoşunu qarşısında son dərəcə böyük mərdanəlik göstərdi.

Bu möhnətli xəbər Təbrizdə Yaqub padşaha çatdıqda kin əhlinin şərini dəf etmək barədə əmirlərlə məşvərət etdi ki, özü Diyarbəkr tərəfə qoşun çəksin, yoxsa hərbi işdə səriştəsi olan qüdrətli bir əmiri o səmtə göndərsin? Əmirlər ikinci fikri bəyəndilər.

Nəzm

"Dərgahda oturanlar ərz etdilər ki,
Biz bütün məsələlərdə bəndələrik.
Bəbirə layiq deyildir ki,
Dovşanla döyüşə çıxsın.
Qarışqanı boğmaq üçün bir damcı su bəsdir,
Onun üzərinə Ceyhun [çayını] axıtmağa nə lüzum var?!
Bir şamla bir aləmi yandırmaq olar,
Nə hacət var məşəl yandırmağa?!"

Ona görə də Yaqub padşah, Bayandur bəyi, Sufi Xəlili, Süleyman bəyi və Həsən ağa Çələbioğlunu çoxlu qoşunlarla Misir ordusuna qarşı savaşa göndərdi. Yaqub padşah vida zamanı Bayandur bəyə dedi:

- Dayandığın hər mənzilbaşında gərək məni xəbərdar edəsən.

---

[1352] Bodrum – Türkiyənin Egey regiounында, Muğla vilayətində sahil şəhəri.

[1353] Paris nüsxəsi: "O, hələ gəmidən enməmişdi ki, sultanın vəzirliyi mənsəbindən çıxarıldığı haqqında hökm gəlib çatdı və Gelibolu hakimliyinə təyin edildiyi üçün oraya yola düşdü". Məsih paşa əslən Bizans imperatorlarının Paleoloq sülaləsindən idi və Uzun Həsənlə savaşda öldürülmüş Xas Murad paşanın qardaşı idi *(Nəvai, şərhlər, s.834).*

Sonra əmirlər qəzəb və kin üzündən böyük ordu ilə Təbrizdən çıxıb hərəkət bayrağını Diyarbəkrə doğru qaldırdılar. Əvvəla onların yanına şirin dilli elçilər göndərib sülhdən söz açdılar və dedilər:

- Yaxşı olar ki, dönüş təbilini çalıb öz diyarınıza qayıdasınız. Çünki düşmənçilik ağacı peşmançılıq meyvəsi yetirər və münaqişə toxumu ölüm məhsulu bitirər.

Şeir

“Dostluq məclisi işıqlandıran bir şam olar,
Düşmənçilik isə ev yandıran bir atəş olar.
Döyüş şöləsini alovlandırma,
Məbada, ondan sənə də bir qığılcım düşər”.

Başbəy onların sözünü qəbul etmədi. Əmirlər Ruhaya yönəldilər. Misir qoşunu da şəhərdən çıxıb, yüklərini qalada qoyaraq şəhərin xaricində səf çəkdi. Misir igidləri dəstə-dəstə, şövkətli bir şəkildə dağdan dağa qədər dayanmışdılar və hamısı dəmirə və polada qərq olmuşdular. Başbəy Şam əmirülümərası olan Qanisav Yəhyavini sağ cinaha göndərdi, sol cinahı Hələb hakimi Özdəmirin vücudu ilə möhkəmlətdi, özü isə nizənin ucu ilə ayın üzündəki ləkələri qoparan sultanın xassə qulamları ilə ordunun mərkəzində qərar tutdu. Bu tərəfdən də Bayandur bəy, Süleyman bəyi sağda, Sufi Xəlili solda qoydu və özü ordunun mərkəzində yerləşdi. Aslan yıxan igidlər və düşmən qıran aslanlar igidlik meydanına qədəm qoydular və cəsarət əlini şücaət qolçağından çıxarıb bir-birinə həmlə etdilər.

Şeir

“Gürz, kəmənd və nizə ilə həmlə etdilər,
Qırdılar, bağladılar və yıxdılar.
Kaman gözəllərin qaşı kimi can alırdı,
Qaşa işarə edərək ox atırdı.
Zireh nisan (aprel) buludundan çox ağlayırdı,
Yüz gözlə öz halına qan ağlayırdı.
Başdan-başa təbərzin qandan al qırmızı olmuşdu,
Şəfəqin içindəki hilal kimi görünürdü.
Qızıl kəmərlər qandan lalə rəngli olmuşdu,
İgidlər kəmərə qədər qan dənizinə batmışdı”.

Misir ordusu ardıcıl həmlələr edib türkman qoşunlarını yerindən dəbərtdi. Bayandur cəsur igidlərdən [ibarət] bir dəstə ilə tuğu aşağı endirib, ərəblərin içinə daxil olaraq Başbəyin əmirlərindən olan Bəhlul adlı birisini atdan saldı. Misir ordusu o halı müşahidə etdikdə, döyüş meydanından üz döndərib fərar vadisinə tələsdi. Türkman ordusu onları təqib edib, Qanisav Yəhyavini və Özdəmiri cəsur igidlərdən [ibarət] bir dəstə ilə birlikdə əsir alaraq əmirlərin nəzərləri qarşısına gətirdi. Əmirlərin hökmü ilə onların başlarını kəsib, qətlə yetirilmiş digər əsirlərin başları ilə birlikdə xilafət əlamətli taxtın ətəyinə gətirdilər. Bunları Yaqub padşahın nəzərinə çatdırdıqda Nəcm bəy Vəkil[1354] bədahətən bu beyti dedi:

Beyt

“Dəfələrlə dedim sənə, ey bəxti dönmüş Baş,
Hələbdən çıxma və qəndildə hazır ol!”

Bayandur bəy zəfər və qələbə ilə geri döndükdə Yaqub padşah onu Müşəşə hakimi Məhəmməd Fəllahı dəf etməyə göndərdi.

### Müxtəlif əhvalatlar

Bu il nəsəbi Şeyx Bayəzid Bistamiyə çatan Şəmsəddin Məhəmməd adlı şəxs Qəzneyndən Kabilə gedib Məlikşahın [oğlu] Sultan Səncər[1355] zamanında yazılmış bir tarix kitabını ortaya çıxardı. O kitabda qeyd edilmişdi ki, Allahın qalib aslanı və möminlərin əmiri Əli ibn Əbu-Talibin – ona salam olsun – məzarı Xoca-Xeyran kəndindədir. Ona görə də Mirzə Bayqara Bəlxin seyidlərini və qazılarını toplayıb, Bəlxdən üç fərsəx-

[1354] Qazı İsanın bacısı oğlu Şeyx Nəcməddin Məsud nəzərdə tutulur. O, sultanınköməkçisi və ya vəkili idi *(Nəvai, şərhlər, s.837).*
[1355] Sultan Səncər – Böyük Səlcuq hökmdarı (1118-1157).

lik məsafədə yerləşən həmin kəndə tələsdi. Kitabda göstərilmiş yerdə bir günbəz gördülər ki, içində bir qəbir vardı. Buyurdu ki, qəbri qazısınlar. Qazıdıqları zaman daşdan ağ bir lövhə tapdılar ki, üzərində [ərəbcə bu yazılar] həkk edilmişdi: "Bu, Allahın aslanı və Rəsulullahın qardaşı Əli Vəliyullahın qəbridir"[1356].

Bu xəbər vilayətlərin hər tərəfinə yayıldıqda xroniki xəstəliklərin daşıyıcılarından və vilayətlərin sakinlərindən [ibarət] bir dəstə adam o cənnət nişanlı astanaya üz tutdu. Şəfa diləyənlərin bir qismi sağaldı. Sultan Hüseyn mirzə özü də oraya tələsib [orada] bir qübbə tikdirdi və Bəlxin nəhrlərindən biri olan və Nəhri-Şahi kimi tanınan nəhri o mübarək məqbərəyə vəqf etdi.

Bu əsnada Herat arabaçılarından olan bir fırıldaqçı, şam namazı vaxtı Gazərgahda, Xoca Abdulla Ənsarinin məzarı yaxınlığında fəryad etməyə və paltarını cırmağa başladı. Camaat onun yanına gəldikdə dedi:

- İndi bu səhrada mənə dörd süvari göründü və dedilər ki, Şahi-Mərdan Əlinin – ona salam olsun – məzarı filan yerdədir.

Sonra o, daşyonan Şəmsəddinin qəbrinə yaxın bir daş parçasına işarə etdi. Camaat arabaçı ilə birlikdə o tərəfə gedib, orada bir qəbir düzəldərək zikr etməyə və hay-küy salmağa başladılar. Sonra həm say-seçmə, həm də sadə adamlar arabaçıya üz tutub onun ayağının torpağını gözlərinə tutiya etdilər. Bir kor və topal o qəbirə gəlib alnını torpağa qoyduğu zaman arabaçının adamları və qələndərlər ondan soruşurdular ki, "xəstəliyin sağaldımı, sağalmadımı?". Əgər "bəli" desəydi, onu qaldırıb salavat göndərərdilər və əgər desəydi ki "xəstəliyim sağalmadı", o biçarəni şəkk gətirməkdə və münafiq olmaqda ittiham edib təpik altına salardılar.

Arabaçı on beş gün ərzində camaatdan çoxlu qızıl aldı. Bir sıra tamahkar adamların da başına belə bir həvəs düşdü və hər yerdə bir imamın zühur etdiyi sədasını yaydılar. Arabaçı rüsvay olacağından qorxub qaçdı. Sultan Hüseyn mirzə, Mövlana Kəmaləddin Şeyx Hüseynə onları ədəbləndirməyi əmr etdi. Adı çəkilən şəxs onları çox azarladı və beləliklə, həmin qovğa sakitləşdi.

Həmçinin bu il Rum padşahı Sultan Məhəmməd qoşun göndərib Gürcüstana daxil olan Betrul[1357] qalasını fəth etdi. Onun qoşununun bir qismi də Çərkəz[1358] vilayətinə basqın edib Quban (Kuban) qalasını ələ keçirdi.

Həmçinin bu il firənglilər Sultan Məhəmmədə çoxlu töhfələr və hədiyyələr göndərərək cizyə [verməyi] qəbul etdilər və Moranın bütün qalalarını sultanın məmurlarına təslim etdilər.

Həmçinin bu il Sultan Məhəmməd, Gədük Əhməd paşanı çoxlu qoşunlar və saysız top-tüfənglə Firəng vilayətlərinin ən böyüklərindən olan Boliya vilayətini ələ keçirməyə yolladı. Əhməd paşa da mötəbər qalaları və məntəqələri olan o məmləkəti ələ keçirdikdən sonra əsas diqqətini bütün Firəng məmləkətini fəth etməyə yönəltdi və Romanın fəthinə başlamaq üçün planlar qurdu.

## 886-CI İLDƏ (02.03.1481 – 19.02.1482) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Bayandur bəyin Yaqub padşah Türkmana qarşı müxaliflik etməsi

Bayandur bəy belə bir qələbə qazandığı və bundan öncə də bəzi döyüşlərdə bahadırlıq və igidliklər göstərdiyi üçün bu səfərdən qayıtdıqdan sonra beyni qarışdı, özünün səltənət və hökmdarlıq işinə Yaqub padşahdan daha çox haqqı çatdığını və daha layiq olduğunu sandı. O, öz şücaətinə və cəsarətinə güvəndi və onun beynində padşahlıq xəyalı yer tutdu. Ona görə də həmişə boş təsəvvürlərlə və fitnəkar xəyallarla səltənət sevdasına düşdü. Nəhayət ki, padşah, Məhəmməd Fəllahı və peyğəmbərlər ağasının (Məhəmməd peyğəmbərin) düzgün şəriətinə və mətin dininə müxalif olan Müşəşə tayfasını qırıb-biçməyə qərar verdi. Ali əmr verildi ki, Bayandur bəy yola düşüb, o məmləkətin qoşununu toplayaraq Bağdad yolundan Cəzairə getsin və Fars əmirləri Cəzireyi-Şüştər yolundan gedərək o alçaqların diyarını dağıtmaqla məşğul olsunlar.

Bayandur bəy bu məqsədlə Səhənd yaylağından İraqa hərəkət etdi. O, Həmədan ətrafına çatdıqda, düzgünlük yolundan azaraq Yaqub padşaha müxalif çıxmağı qət etdi. Lakin bilirdi ki, öz iddiasını aşkara çıxardığı zaman hüdud əmirlərindən heç kim onun dəvətini qəbul etməyəcəkdir. Ona görə də məkr və hiylə iş-

---

[1356] Bu ziyarətgah Əfqanıstanın şimalında, Bəlxdən şərqdə yerləşən Məzari-Şərif şəhərindədir.
[1357] Batum olmalıdır *(Öztürk, şərhlər, s.567)*.
[1358] Farsdilli qaynaqlarda Çərkəz vilayəti və çərkəzlər adı altında Şimali Qafqaz və orada yaşayan xalqlar nəzərdə tutulur.

lədib, yan-yörədəki və ətrafdakı hakimlərə və əyan-əşrəflərə bir neçə qasid göndərərək onları dövlətin mənafeyi naminə [yanına] çağırdı. Həmin camaat toplaşdıqdan sonra o adamların hər biri ilə fərdi qaydada xəlvətdə görüşüb onları arxayın etdi ki, "Yaqub padşah varlıq yükünü əbədiyyət aləminə çəkib aparmışdır (ölmüşdür) və indi hökmdarlıq mənə məxsusdur". O, onların hər birinə əvvəlkindən daha artıq lütfkarlıq və ehtiram göstərəcəyini vəd etdi. Onlar onun amansızlığından və qəddarlığından çəkindikləri üçün istər-istəməz ona itaət etdilər.

O, İraq əmirlərini zorla və güclə itaət və tabeçilik boyunduruğuna saldıqdan sonra Hacı bəy Alpavutu və Mənsur bəy Söhrabı əmirlik divanına (divani-əmarət) təyin etdi və böyük bir ordu ilə İsfahana yönəlib oradan mali-amani topladı. Onun əsgərləri də İraqın ətrafına yayılıb, bir dəqiqə belə olsun, zülmdən və sitəmdən əl çəkmədilər və ağır tələblər və müsadirələr həyata keçirdilər. Bu minvala haram və günah işləyib, bir qədər mal toplayaraq öz qoşununun avaralarına və alçaqlarına payladı. İraq məmləkətlərini və əsgərlərini ələ keçirdikdən sonra istədi ki, məkr və hiylə ilə paytaxt əmirlərini padşahdan və padşahı da onlardan bədgüman etsin. Əmirzadə Osman Miranşahiyə yalanla dolu olan bir məktub yazdı ki, məzmunu belə idi: "Bizə göstərdiyin sədaqət, hüzurumuza ərz edilmiş və çatmışdır. Düşmənlərin qoşununun məğlubiyyətə uğradılması barədə tədbirin və səflərin üzləşməsi zamanı bizim əsgərlərimizə qoşulmaq niyyətin qəbul edilmiş və razılıqla qarşılanmışdır. İnşallah, bu yaxşı xidmətinin nəticəsində bütün istək və arzularına ən gözəl bir tərzdə çatacaqsan". Halbuki Əmirzadənin bu məsələdən heç bir vəchlə xəbəri yox idi. [Bayandur bəy] tapşırmışdı ki, casus bu məktubu padşahın yaxınlarından birinin evinə atsın. Yaqub padşah [məktubun] məzmunundan xəbər tutduqda əsla məhəl qoymadı və bunun məkr və hiylə olduğunu başa düşdü. O, Əmirzadə Osmanın könlünü alıb onun ürəyini rahatlatdı.

Xülasə, Bayandur bəyin üsyanı və tüğyanı padşahın qulağına çatdıqda, onun əsgərləri dağınıq halda olsa da, dərhal düşmənləri dəf edib qırmaq və o tüğyanın kökünü kəsmək üçün İraq tərəfə köç etdi. Şəhərdən çıxdığı gün Vasminc[1359] kəndində dayandı. Yanında olan əsgərlərin sayı təxminən iyirmi mindən artıq deyildi. Oradan köçə-köçə tam sürətlə İraqa yönəldi.

Bu xəbər İsfahanda Bayandur bəyin qulağına çatdıqda İraq qoşununu toplayıb, İsfahanın böyüklərini və əyanlarını özü ilə götürərək əzəmətli bir izdihamla Savə və Qum tərəfə üz tutdu. Qum ətrafına çatdıqda, İsfahan böyükləri ordugahdan ayrılıb Kaşan tərəfə yolandılar. Bayandur bəy Savə ətrafına çatdıqda, əvvəlcə Savə camaatı qala təslim etməkdən boyun qaçırdı. Lakin axırda bir az səy göstərildikdən sonra darvazanı onun üzünə açıb şəhəri təslim etdilər. Bayandur bəy Savənin fəthini öz dövlətinin həyata keçirəcəyi fəthlərin başlanğıcı sayıb ümidvar oldu.

Padşahın bayraqlarının yaxınlaşdığı aydın olduqda, Bayandur bəy Savədən çıxıb şəhərin şərqində yerləşən bir dağda qərar tutdu. Bu tərəfdən padşah o vaxta kimi harada olduğu və nə xəyal etdiyi məlum olmayan yağının halını öyrənmək üçün Sufi Xəlili qabaqcadan göndərmişdi və özü də onun ardınca hərəkət edirdi. Bayandur bəyin Savə ətrafında döyüş və vuruş səfi qurduğu, könlünü qorxaqlıq və cəsarətsizlikdən təmizlədiyi məlum olduqda Yaqub padşah ordunu tərtib etməklə məşğul oldu. O, özü mərkəzdə qərar tutdu, Osman bəy Miranşahini mənqəlay [təyin] etdi, Süleyman bəyi sağ cinaha göndərdi. Cinahları və mərkəzi bu tərtiblə düzəltdikdən sonra Savə tərəfə hərəkət etdi.

Şeir

"Ordunun mərkəzi, sağ və sol cinahları,
Günəşə və aya bayraq çatdırdılar.
Döyüş mühiti hərəkətə gəldi,
Bədxahın taleyi alt-üst oldu.
Qoşunun tapdağı altında yerin titrəməsindən,
Dünyanı belində saxlayan öküzün bədəni sınağa çəkildi".

Savə səhrasına çatdılar. Sağ və sol cinahları, mərkəzi və mənqəlayı tərtib etdilər. Amma hər nə qədər axtarsalar da, Bayandur bəyin qoşunundan əsər-əlamət görmədilər. Qəflətən sol tərəfdən böyük bir tüstü göründü. Qoşun o tərəfə yönəldikdə Bayandur bəyin səfləri peyda oldu. Mənqəlay [komandanı] olan Əmirzadə

---

[1359] Bu, Təbrizdən şərqdə yerləşən indiki Basminc kəndidir *(Фазлуллах ибн-Рузбихан Хунджи. Тарих-и алам ара-йи Амини, с.64-65).*

Osman irəli atılıb dağın ətəyində Bayandur bəyin adamlarına çatdı. Bayandur bəy tərəfdən Habil bir dəstə alçaqla irəli cumub mənqəlaya həmlə etdi. Bu halda Bayandur bəyə tabe olmağı özlərinə ar bilən Mənsur bəy, Söhrab bəy və Hacı bəy Alpavut kimi İraq əmirləri bir anda onun qoşunundan ayrılıb padşahın əsgərlərinə qoşuldular. Buna görə də Bayandur qoşunun qalan hissəsinə də bədgüman olub fərar etməyə qərar verdi. Padşah hər kimi onu təqib etməyə təyin etsə də, onlar üzr istəyib imtina etdilər. Axırda Sufi Xəlil onu təqib edib öz adamlarını belə qabaqladı. Bu əsnada Bayandurun atının ayağı bir çalaya düşdü və o, atından ayrıldı. Sufi Xəlil elə bu vaxt qaçılmaz bir bəla kimi onun başının üstünü alıb, başını kəsərək bir dəsmala bağladı və öz mülazimlərindən biri vasitəsilə Savə ətrafında Yaqub padşahın nəzərinə çatdırdı. Bu yaxşı xidmətin müqabilində o, növbənöv nəvazişlər görüb qüdrət payəsini ali dərəcəyə çatdırdı. Hökmdarın məiyyəti Savə şəhərində dayandı.

Ertəsi gün bayram idi. Cah-calalla Qum şəhərinə gəldilər. Həmin gün Habil bəyi digər əsirlərlə birlikdə qətlə yetirdi. Hacı bəy Alpavutu və Mənsur bəy Söhrabı isə şahanə lütfkarlığa və şəfqətə layiq görüb onları yenidən Qum və İsfahan hakimi təyin etməklə şərəfləndirdi.

Beləliklə, İraq məmləkəti Yaqub padşahın əlinə keçdi. Acizlərdən və rəiyyətdən hər kəs narahatlıq və təşviş olmadan, arxayınlıqla öz mənzilində və məskənində qərar tutdu. Elə bu vaxt muştuluqçular Təbriz tərəfdən Mirzə Baysunqurun doğum xəbərini gətirdilər. Ona görə də həmin bayramda həm düşmənin məğlubiyyəti, həm də göz bəbəyinin doğumu üzündən Yaqub padşahın bayramı bayrama qarışdı. O, sürətlə yola çıxıb Təbriz tərəfə qayıtdı, o cənnət nişanlı şəhərdə şahanə toylar (ziyafətlər) tərtib etdi və Şirazı şahzadənin ölkəsi təyin etdi.

## Müxtəlif əhvalatlar

Bu il Gədük Əhməd paşa on altı gəmi ilə sultanın dərgahına yönəldi. Əhməd paşanın qorxusundan İtaliya məmləkətinə qaçmış Boliya padşahı[1360], Əhməd paşanın sultan dərgahına tələsdiyini eşitdikdə qırx gəmi ilə onun ardınca təcili surətdə yola çıxdı. Firəng əhli dəniz səfərində su quşlarından daha çevik olduğu üçün o, tam sürətlə Əhməd paşaya çatdı. Əhməd paşa döyüşməyi məsləhət bilməyib mümkün qədər sürətlə İstanbul tərəfə hərəkət etdi[1361]. O (Boliya padşahı), onun (Əhməd paşanın) boş gəmilərini ələ keçirib öz vilayətinə qayıtdı.

Həmçinin bu il Yaqub padşah məmaliki-məhrusənin bütün vergilərini (ixracat) [camaata] bağışladı.

## Rum padşahı Sultan Məhəmmədin vəfatı və Cəm sultanın Sultan Bayəzidlə müharibə etməsi

Bu il Sultan Məhəmməd çoxlu ordu ilə dənizdən keçib, Anadolu məmləkətinə yönələrək Gəbzə[1362] ətrafında dayandı. Bu əsnada o, bir xəstəliyə tutuldu. Hərçənd təbiblər və həkimlər müalicədə səy göstərsələr də, bir faydası olmadı. Nəhayət, pəncşənbə günü, rəbiüləvvəl [ayının] 3-də[1363] fani dünyadan əbədi aləmə köçdü.

Həmin vaxt Mövlana Cəlaləddin Ruminin nəslindən olan vəziri-əzəm Məhəmməd paşa belə bir söz yaydı ki, "sultan niqris (podaqra) xətəliyinə tutulub, onu hamama aparıram". Sultanı bir məhfəyə qoyub İstanbula apardı. Mərhum sultanın oğlu Sultan Bayəzidə qasidlər göndərərək onu çağırdı. Məhəmməd paşa yeniçərilərin qorxusundan bir guşədə gizləndi. Axırda onların əlinə düşdü və onu öldürdülər. On doqquz gün sonra Sultan Bayəzid gəlib səltənət taxtında oturdu. Bir evdə gizli saxladıqları Sultan Məhəmmədin cəsədini ortaya çıxardılar. Onu yuyub kəfənlədikdən, namazını qıldıqdan və dua oxuduqdan sonra özünün tikdirdiyi yeni cümə məscidinin xaricində dəfn etdilər.

Sultan Məhəmmədin ölüm xəbəri kiçik oğlu Cəm sultana çatdıqda o, böyük bir ordu ilə Qaramandan Bursaya gəldi. Ona görə də Sultan Bayəzid suyu keçib, köçə-köçə Bursaya yönəldi. Cəm sultan da qantökən ordu ilə birlikdə döyüşə və vuruşa yollandı. Yengişəhər yaxınlığında iki ordu qarşılaşdı. Çoxlu çalış-vuruş-

[1360] Leonardo Tuço nəzərdə tutulur *(Nəvai, şərhlər, s.844).*

[1361] Nuruosmaniyyə nüsxəsi: "O, dəniz kənarında Əhməd paşaya çatdıqda Əhməd paşa salamatlıqla aradan çıxdı".

[1362] Mətndə: "Gülbizə". Gəbzə (Gebze) – Türkiyənin Kocaeli vilayətinin bir ilçəsidir.

[1363] Rəbiüləvvəl ayının 3-ü pəncşənbəyə deyil, çaharşənbəyə təsadüf etmişdir. Əslində isə Sultan Məhəmməd Fateh pəncşənbə günü, 4 rəbiüləvvəl 886 / 4 may 1481-ci il tarixində vəfat etmişdir *(Öztürk, şərhlər, s.571).*

dan sonra Cəm sultan ağır məğlubiyyətə düçar olub tamamilə kədər içində Qaramana yola düşdü. Sultan Bayəzid onu təqib edərək həmin diyara hərəkət etdi. Cəm sultan Qaramanı da qoyub qaçdı. Sultan Bayəzid o diyarın hakimliyini Gədük Əhməd paşaya verərək İstanbul tərəfə döndü.

**Müxtəlif əhvalatlar**

Bu il firənglər Boliya qalasını tutub müsəlmanlardan bir çoxlarını əsir apardılar.

Həmçinin bu il Əlvənd ibn Sultan Xəlil ibn Həsən padşah Şirazda vəfat etdi. Hüseyn Əli, Həmzə Hacılu, Qəzənfər bəy Miranşahi, Əbu-Bəkr bəy Bektaş, Hacı bəy Alpavut, Piri bəy və Bəhram Bayandur kimi Fars [vilayətinin] əmirləri Yaqub padşahın dərgahına ərizə göndərib daruğa istədilər.

**Ölümlər**

Bu il rəcəb ayında (26.08-24.09.1481) Pir Cəmaləddin Məhəmməd Ərcistani vəfat etdi.

Daha öncə qeyd olunduğu kimi, əsli bir neçə vasitə ilə Oğuz [xana] çatan Sultan Məhəmməd ibn Sultan Murad ibn Sultan Məhəmməd ibn Sultan İldırım Bayəzid ibn Sultan Murad xan ibn Orxan ibn Sultan Osman ibn Ərtoğrul ibn Süleyman ibn Qaya Alp bu il vəfat etdi. O, alim və alimpərvər bir padşah idi. O, həmin dövlətin cövhəri və o qövmün ən seçkinidir. Yadigarlarından biri İstanbuldakı son dərəcə əzəmətli və zinətli bir məsciddir.

Şeir

“Döşəmədən tavana qədər naxışla və bəzəklə doludur,
Mühəndis fikrini və nəzərini ona vəqf etmişdir.
Yuxarıdakı ali otaqları pis gözdən uzaqdır,
Qövsvari tağları hurilərin qaşı kimidir”.

Orada hər gün “Onlar öz iştahaları çəkdiyi halda yeməyi yoxsula, yetimə və əsirə yedirərlər”[1364] ayəsinə uyğun olaraq, fəqirlərə və zəiflərə yemək verərdi, hər gecə min at yükü arpa paylayardı və digər xərcləri də bununla müqayisə etmək lazımdır. Mövlana Cami onun adına parlaq qəsidələr demişdir ki, bu bir neçə beyt o cümlədəndir:

Nəzm

“Az adam vardır cah-calal taxtında ki,
Sənin kimi fəzilət və kamal kəsb etmiş olsun.
Müşkül hikmət sənin kəlamınla həll olar,
Sənin məntiqin hər məsələni bəyan edər.
Sənin fikrin riyaziyyat barədə rəy deyəndə,
Riyaziyyat cənnətin bəzəyi olan bağçaya dönür”.

O, alimlərə və fazillərə ehtiram göstərməkdə təqsirə və səhkənkarlığa yol verməzdi. Dəfələrlə Mövlana Cəlaləddin Məhəmməd Dəvvaniyə, başqa alimlərə və şairlərə şahanə töhfələr göndərmişdi. Ədalət nurunun sığalı ilə rəiyyətin camal aynasını cövr tozundan və zülm zülmətindən təmizləyərdi. Vilayətlərin, istehkamların və qalaların zəbti üçün təcrübəli igidləri və seçkin mübarizləri təyin edərdi. Əksər vaxtlarda səfərdə olardı. Belə ki, islam və kafir padşahlarından iyirmi iki vilayət alıb öz ölkəsinə qatmışdı. Təfsilatı belədir:

- Kafirlər məmləkətinin özəyi və ali dərəcəli qeysərlər diyarının ən gözəl məskənləri olan, Firəng və Engirüs məmləkətləri ilə Rumelidəki Makedon mülkü arasında yerləşən Bosna məmləkətlərinin fəthi;
- Kafirlərin bütün dağlıq bölgələrinin ən çətini və üsyankar məliklərin, yaramaz hakimlərin məskəni olan, Firəng dənizinin[1365] şimal sahilində yerləşən, Makedon diyarına bitişik Arnavut vilayətlərinin fəthi;
- İlk fəthi – əvvəlki qeysərlərin paytaxtı olan darüssəltənə Qüstəntiniyyənin alınması;
- Mis mədənlərinə malik və müqayisəyəgəlməz gəlirlərə sahib İsfəndiyaroğulları ölkəsinə daxil olan məmləkətlərin fəthi. Onun şəhərləri Kastamonu, Sinop və Cəzirətül-Üşşaqdır[1366];

[1364] *Qurani-Kərim, “İnsan” surəsi, 8-ci ayə.*
[1365] Firəng dənizi ifadəsi, geniş mənada Aralıq dənizini və ona bitişik digər dənizləri (Adriatik, Egey) əhatə edir.
[1366] Cəzirətül-Üşşaq – Sinopun tarixi adlarındandır.

- Digəri, illərlə Səlcuq sülaləsinin hökumət yeri və Yunan (İoniya) mülkünün özəyi olan Qaramanın gözəl məmləkətlərinin və şəhərlərinin fəthi;

- Böyük Ərməniyyənin (Ərməniyyeyi-Kübra) paytaxtı və böyük qeysərlərin qalıqlarının[1367] hökumət mərkəzi olmuş, gürcü məmləkətlərinə və İranzəminin bəzi vilayətlərinə bitişik Trabzon məmləkətinin fəthi;

- Gümüş və qızıl mədənlərinə, istehkamlara və qalalara malik çox gözəl bir ölkə olan, Rumeli və Engirüs məmləkətləri arasında, Tuna çayının yaxınlığında yerləşən və əlahiddə şəkildə ordu və təbəə sahibi olan kafir hökmdarlara məxsus Las (Serbiya) məmləkətlərinin fəthi;

- Arnavut və Bosna arasında yerləşən, müşriklərin böyük hökmdarlarından birinin hökumət yeri olan, dəniz sahili məhsullarına və mədənlərə malik, Bosna və Arnavut məmləkətlərinin qonşuluğunda və arasında, Firəng (Adriatik) dənizinin hüdudunda yerləşən Hersek vilayətinin fəthi;

- Şimal dənizinin (Qara dənizin) kənarında, Dəşti-Qıpçağa bitişik sahilyanı ərazidə yerləşən və Firəng məliklərinin qalıqlarının[1368] özünü və ətrafını istila etdikləri bir məmləkət olan Kəfə qalasının və məmləkətinin fəthi;

- Yunan adalarının ən gözəli və təmizi olan, Firəngin, Rumelinin və müsəlman məmləkətlərinin sahil vilayətləri arasında yerləşən Ağrıboz adasının və vilayətinin fəthi;

- Yunan adalarının ən böyüyü və yüksək şöhrətli qeysərlərin qalıqlarının[1369] hökumət məkanı olan Mora vilayətinin müəzzəm məmləkətlərinin fəthi;

- Anadolu islam məmləkətlərinin yaxınlığında yerləşən, meyvələrlə və hər cür məhsullarla dolu məskənlərdən ibarət olan, bəzi Firəng məlikləri tərəfindən idarə edilən Midilli adasının fəthi;

- Divani məmləkətlər cümləsindən sayılan, Əcəm mülkü ilə Rum diyarı arasında yerləşən, müsəlman diyarlarından olan və Həsən bəy padşahın vəkillərindən qol gücü ilə alınan möhkəm Qarahisar qalasının və diyarının fəthi;

- Şimal dənizinin (Qara dənizin) cənub sahilində yerləşən, Böyük Ərməniyyə diyarına aid olan, Trabzon və Anadolu məmləkətləri arasında yerləşən və qədim hakimləri türk tayfalarının məliklərindən ibarət olan Yuxarı və Aşağı Canik vilayətinin fəthi[1370];

- Firəng dənizinin sahilində və Anadolu diyarının qərbində yerləşən, Səlcuqlarının qalıqlarının illər boyunca qaldıqları və müstəqil surətdə idarə etdikləri istehkamlı Alanya şəhərinin və onun məmləkətlərinin fəthi;

- Trabzona bitişik olan və Böyük Ərməniyyə məliklərinin qalıqlarının hökm sürdükləri Torul qalasının və vilayətinin[1371] fəthi;

- Şimal dənizi (Qara dəniz) kənarında yerləşən və bəzi Firəng məliklərinin[1372] hökumət yeri olan Amasra qalasının və vilayətinin fəthi;

- Türkman məmləkətlərindən olan, Trabzonun və Ərzincanın yaxınlığında yerləşən və çoxlu əraziləri və qalaları olan Qoyluhisar qalasının və vilayətinin fəthi;

- Firəng dənizi sahilində, Ədirnə və İpsala yaxınlığında yerləşən və kafir məliklərin qalıqlarından biri tərəfindən idarə olunan Enos[1373] qalalarının və vilayətinin fəthi;

- Semendire və Bosna vilayəti arasında yerləşən, xorvat hakimlərinin qalıqları tərəfindən idarə olunan Zvornikin fəthi;

---

[1367] Bizans imperatorlarının Komnenlər sülaləsi Trabzonda 1204-1461-ci illərdə hakimiyyətdə olmuşlar. Onlar özlərini Trabzon imperatorları adlandırırdılar. Lakin Trabzon heç vaxt Ərməniyyənin paytaxtı olmamışdır.

[1368] Genuya Respublikasının idarəçiləri nəzərdə tutulur.

[1369] Bizans imperatorlarının Paleoloq sülaləsindən olan Tomas və Dimitrius (Foma və Dimitri) nəzərdə tutulurlar. Onlar Bizansın son imperatoru Konstantinin qardaşları idilər *(Nəvai, şərhlər, s.850).*

[1370] Göründüyü kimi, müəllif Trabzon və Canik bölgəsini "Böyük Ərməniyyə" ("Ərməniyyeyi-Kübra") diyarına aid etsə də, bu termini etnik anlamda deyil, antik coğrafiyaşünaslığın yanlış ənənəsindən qalmış coğrafi bir termin olaraq işlətmişdir. Çünki müəllif oranın "qədim hakimlərinin türk tayfaları məliklərindən" ibarət olduğunu qeyd edir. Beləliklə, Həsən bəy Rumluya görə, həmin ərazilər erməni deyil, türk torpağıdır və qədimdən türklərin idarəçiliyi altındadırlar.

[1371] Torul – indiki Türkiyə Respublikasının Gümüşhane vilayətinə bağlı Torul ilçəsi.

[1372] Genuya Respublikası nəzərdə tutulur.

[1373] Enos – Türkiyənin Ədirnə vilayətinin Enez ilçəsi.

- Dubrovnik[1374] məmləkəti yaxınlığında yerləşən, Firəng məliklərindən alınan və indi İslam diyarına daxil və tabe olan Qüznovoğlu (?) vilayətinin fəthi[1375];

- Kəfə və Ağkirman[1376] vilayətinə bitişik olan, Şimal dənizi (Qara dəniz) sahilində yerləşən və firənglərin hökumət mərkəzi olan Menkubun fəthi.

## 887-Cİ İLİN (20.02.1482 – 08.02.1483) HADİSƏLƏRİ

### Sultan Bayəzidin yenidən Cəm sultanla müharibə etməsi və onun (Cəm sultanın) məğlub olub Firəng tərəfə qaçması

Bu il Sultan Bayəzidə ərz etdilər ki, Cəm sultan yenidən çöl qumundan daha çox qoşun toplayıb və intiqam qılıncını çəkib, köçə-köçə Qaraman vilayətinə yönəlmişdir. Ona görə də Sultan Bayəzid dənizdən keçib yola düşdü. O diyarın həndəvərində ağır bir hərb baş verdi. Cəm sultan yenidən məğlub olub Firəng tərəfə qaçdı. Müxaliflərin məğlubiyyətindən sonra Sultan Bayəzid Qaraman diyarında çadır və bargah quraraq, savaşda əsir düşənlərin bir çoxlarını qətlə yetirib İstanbula qayıtdı.

### Ölümlər

Vəziri-əzəm Gədük Əhməd paşa bu il öldürüldü. Sultan Bayəzid ali bir məclis tərtib edib, Rum böyüklərinə o məclisdə dəyərli xələtlər verdi. Həmin məclisdə Əhməd paşanı çağırdı və gecə yarısı onu qətlə yetirdi.

Tarixçi Mövlana Əbdürrəzzaq Səmərqəndi bu il Heratda fani aləmdən əbədi cahana köçdü. O, Sultan Əbu-Səidin qazı-əsgəri olan Mövlana Cəlaləddin İshaq Səmərqəndinin sevimli oğludur. Mövlana Əbdürrəzzaq, Şahrux padşahın xidmətində idi. O həzrətin əmri ilə Bicanəgər[1377] padşahına elçi getmişdi. Şahrux padşahdan sonra Mirzə Əbdüllətifə, Mirzə Abdullaya, Mirzə Babura və Mirzə İbrahimə xidmət etmək izzəti ilə şərəflənmişdi. Sultan Əbu-Səidin zamanında Şahrux padşahın xanəgahının şeyxliyi mənsəbinə təyin edilmişdi. “Mətləüs-səədeyn” kitabı və “Şərhi-risaleyi-ismü hərfi-Qazı Əzüdüddin İci” (“Qazı Əzüdüddin İcinin isim və hərf risaləsinin şərhi”) onun əsərlərindəndir. Ömrünün müddəti yetmiş bir il olmuşdur.

## 888-Cİ İLİN (09.02.1483 – 29.01.1484) HADİSƏLƏRİ

### Yaqub padşahın cihad üçün Gürcüstana getməsi

Bu il Yaqub padşah böyük qoşun və sonsuz bir izdihamla Gürcüstan vilayətinə yönəldi. Orucluq ayında (oktyabr, 1483) islam qoşunları qiyamçı kafirlər diyarına daxil oldular, Axısqa ətrafında dayandılar və o diyarın qalasını mərkəz kimi dövrəyə aldılar.

Şeir

“Qala demə, sanki Fərhadın dağı idi,
Onun əsası zülm daşından idi.
Müdrik insanların düşüncəsi kimi yüksək idi,
Və düşüncələrin kəməndi ona çatmaqda aciz idi.
Göy qübbələrinə bənzəyən o qaladan,
Parlaq günəş qaldırmışdır başını”.

Zəfər aqibətli əsgərlər top zərbəsi ilə o qalanın bürclərindən birini dağıtdıqda, kafirlər dərhal dəmir alətlərlə o bürcü möhkəmlətdilər. O əsnada qalanın anbarına od düşdü və qalanın əksəri yandı. İgid türkmanlar və cəsarətli igidlər şücaət qalxanını başlarına çəkib qalaya yürüş etdilər və qala divarına nərdivanlar qo-

---

[1374] Dubrovnik – Xorvatiyanın Adriatik dənizi sahilində yerləşən şəhər.

[1375] Ə.Nəvai burada sultanın Qazıqlu Voyvodanın əlindən aldığı Əflaq (Valaxiya) məmləkətinin nəzərdə tutulduğunu təxmin edir *(Nəvai, şərhlər, s.851).* Lakin mətndə Dubrovnikin adının çəkilməsi bu ehtimalı azaldır.

[1376] Ağkirman (Akkerman) qalası – Ukraynanın Qara dəniz sahilində, Odessadan cənub-qərbdə yerləşən Belqorod-Dnestrovski şəhərindədir.

[1377] Bicanəgər (Vicayanaqar) – XIV-XVII əsrlərdə Hindistanın cənubunda yerləşən hindus imperiyası.

yub bürcün başına çıxdılar. Kafirlər vəziyyətin bu yerdə olduğunu gördükdə, onların əhvalı pərişan və iztirablı oldu və xeyli məşəqqətlə özlərini narınqalaya saldılar. Axırda bürcdən aşağı endilər. Hər kim müsəlman oldusa, aman tapdı. Hər kim iman gətirmədisə, gedər-gəlməzə tələsdi.

Sonra hökmdarın bayraqları Hematun[1378] qalasına yönəldilər. O zaman həmin qalada olan Qurquranın anası[1379] Yaqub padşahın yanına bir keşiş[1380] göndərib aman dilədi. Padşah onların təqsirlərindən keçib qalanın mallarını zəbt etdi və həmin qalada onların əlinə çoxlu cavahirat düşdü. Qurqura öz oğlunu ərizə ilə Yaqub padşahın dərgahına göndərib, əmirlərin vasitəsilə büsatı öpmək izzəti ilə şərəfləndi. Peşkəş kimi gətirdiyi hədiyyələri və töhfələri təqdim edib dedi ki, “əgər padşah öz diyarına qayıdarsa, ənənəvi vergilərdən savayı, dövlət xəzinəsinə (xəzaneyi-amirə) nal bahası kimi əlavə olaraq beş yüz tümən ödəyərəm”. Yaqub padşah ona hörmət göstərib, bahalı hədiyyələr və külək kimi [sürətli] atlar bağışlamaqla şərəfləndirərək [getməyinə] izin verdi. Yaqub padşah da Təbriz tərəfə döndü və bu səfərin müddəti qırx gün oldu.

## Xorasan diyarında baş vermiş hadisələr haqqında söhbət

Bu il Sultan Məhəmməd Həzarə və Məhəmməd Cəlair Barlas on min ailə ilə Hirmənd sahilində qışlaq etdilər. Bu xəbər Sultan Hüseyn mirzəyə çatdıqda o, Mirzə Əbu-Turabı Əmir Zünnun Ərğunla və bahadırlardan bir dəstə ilə birlikdə o qövmə basqın etməyə göndərdi. Onlar tam sürətlə yürüşə çıxdılar. Əmir Zünnun, Mirzə Əbu-Turabdan əvvəl müxaliflərə çatdı. Onlar onu mühasirəyə aldılar. Bu əsnada Əbu-Turab mirzə çoxlu qoşunlarla birlikdə döyüş və vuruş atəşini alovlandırdı. Onlar qaçış yolunu tutdular. Min beş yüz nəfər bacarıqlı igiddən ibarət cağatay qoşunu o yaramazlar zümrəsini gedər-gəlməzə göndərdi və çoxlu qənimətlər ələ keçirib Herata qayıtdı.

## Müxtəlif hadisələr

Bu il Rum padşahı Sultan Bayəzid Sofiya vilayətinə getdi. O, Moranın[1381] üstündə iki qala tikdirdi.

Həmçinin bu il Yaqub padşah Şiraz hakimliyini Sufi Xəlil Mosulluya həvalə etdi və Mənsur bəy Pornakı geri çağırdı. Sufi Xəlil o diyara çatdıqda, orada bir mədrəsə tikdirib Mövlana Şəmsəddin Məhəmmədi o mədrəsənin müdərrisi [təyin] etdi.

Bu il Mir Şəmsəddin Mazandaranda Mir Əbdülkərimlə müharibə etdi və məğlub olub padşahın hüzuruna gəldi. Padşah Rey valisi Bəkir bəy Mosullunu çoxlu ordu ilə ona qoşub Mazandarana göndərdi. Əmir Əbdülkərim qorxub vahiməyə düşərək Mazandaranı onlara təhvil verdi. Lakin Bəkir bəyin çıxıb getməsindən sonra Əmir Əbdülkərim Gilan padşahı Karkiya Mirzə Əlidən kömək istədi. Karkiya gilanlılardan [ibarət] bir dəstəni ona köməyə göndərdi. Mir Şəmsəddin yenidən qaçqın düşdü. Ona görə də Yaqub padşah, Süleyman Bicəni səf yaran bir ordu ilə Rudbara[1382] basqın etməyə göndərdi.

## Ölümlər

Bu il Qaraman vilayətinin padşahı Qasım bəy ibn İbrahim bəy ibn Məhəmməd bəy vəfat etdi. Bu sətirlərin müəllifi olan Əmir sultan Rumlunun nəvəsi Qaraman vilayətində səltənət sürmüş bu sülalədən altı nəfəri müəyyənləşdirmişdir ki, təfsilatı belədir: Məhəmməd bəy, İbrahim bəy, Məhəmməd bəy, İshaq bəy, Pir Əhməd bəy, Qasım bəy. Onların hakimiyyətinin müddəti yüz on bir il sürmüşdür[1383].

---

[1378] Paris nüsxəsi: “Qanun”. Xuncinin əsərində “Xatun” kimi qeyd edilən bu qalanı həmin əsərə yazdığı şərhlərdə V.Minorski gürcü mənbələrindəki Atskur qalası ilə eyniləşdirir (*Фазлуллах ибн-Рузбихан Хунджи. Тарих-и алам ара-йи Амини, с.68,131,149).*

[1379] Samtsxe atabəyi olan II Kvarkvarenin anası nəzərdə tutulur *(Nəvai, şərhlər, s.857).*

[1380] Paris nüsxəsi: “bir kəs”.

[1381] Morava çayının sahili nəzərdə tutulur *(Nəvai, şərhlər, s.858).*

[1382] Rudbar – hal-hazırda İranın Gilan vilayətinin Rəşt şəhristanının beş nahiyəsindən birini təşkil edən dağlıq rayon.

[1383] Qaramanoğulları 200 ildən artıq hökm sürmüşlər. Daha ətraflı bax: *F.Sümer. Karamanoğulları // TDVİA, cilt: 24, yıl: 2001, s.454-460.*

## 889-CU İLİN (30.01.1484 – 17.01.1485) HADİSƏLƏRİ

### Sultan Bayəzidin Qara Boğdana qoşun çəkməsi

Bu il Rum padşahı Bayəzid Qara Boğdan vilayətinə hərəkət etdi və Kili qalası ətrafında dayandı. Çoxlu döyüşdən sonra o qalanı fəth etdi. Sözügedən ilin cəmadiyülaxır [ayının] 3-də (28.06.1484), çaharşənbə günü[1384] Ağkirman vilayətini də ələ keçirdi.

### Sultan Heydər Səfəvinin əhvalı və onun Çərkəz tərəfə qoşun çəkməsi haqqında söhbət

Sultan Heydər, Sultan Cüneydin şəhid olmasından sonra Ərdəbildə yaşayırdı. Şeyx Cəfər bildi ki, o həzrət günbəgün çoxlu tərəqqi əldə edəcəkdir. Ona görə də ürəyində çaşqınlıq, dikbaşlıq, qürur və yöndəmsizlik yer tutdu. Sultan Heydər zərurətdən [onun üzünə] giriş-çıxış qapılarını bağladı. [Şeyx Cəfər] əzəmətli xanədanın müridlərinin və kəramətli sülaləyə etiqad bəsləyənlərin Rum və Şam məmləkətlərindən və digər məmləkətlərdən nəzir olaraq o həzrət (Sultan Heydər) üçün gətirdiklərini tələb edirdi. Halbuki o həzrət (Sultan Heydər) onları ali məclisdə bölüşdürür və qətiyyən onlara meylini salmırdı. Əksər sənətkarlıq növlərini bilirdi və qılınc düzəltməyə daha artıq meyil göstərirdi. Həmişə feyz bəxş edən könlündən bir vasitə ilə özünü Şirvana yetirmək və o diyarı fəth etmək keçirdi. Amma köməkçilərinin və tərəfdarlarının azlığı ucbatından bu istəyini həyata keçirə bilmirdi. Adamlarının sayı altı minə çatdıqda hərəkət bayrağını Çərkəz tərəfə qaldırdı. Müzəffər qazilər kafirlər diyarına doğru hərəkət yüyənini çevirdikdə o diyarın kafirləri məlaikələrin kömək etdiyi və zəfərə vərdiş etmiş qoşunların gəlişindən agah olaraq bəziləri qaçış vadisinə üz qoydular və bir qismi müdafiə məqamında dayandı. Zəfər nişanlı qazilər bəxti dönmüş kafirləin bir çoxunu iti qılınc zərbəsi ilə yoxluq məkanına göndərdilər.

Bu arada Sultan Heydərin könlündən keçdi ki, Şirvana yönəlib şirvanşahın mövcudluq torpağını yoxluq küləyinə versin (onu öldürsün). Sufilərdən bəziləri ərz etdilər ki, qazilər bir neçə gün bir yerdə istirahət edərək döyüş və vuruş ləvazimatlarını tərtib etsinlər. Ona görə də Sultan Heydər Ərdəbil tərəfə qayıdıb əmr etdi ki, qazilər ələ keçirdikləri qənimətləri hərb alətlərinə (silahlanmağa) sərf etsinlər (xərcləsinlər) və özü Ərdəbildə qışlaq etdi.

### Müxtəlif əhvalatlar

Bu il, rəbiüləvvəl [ayının] 21-də (18.04.1484), şənbə gecəsi[1385] Ədirnə şəhərinə od düşdü. İyirmi bazar və qalanın altı yandı. Yenə bu il Sultan Bayəzid Ədirnədə ali bir imarət tikdirdi.

## 890-CI İLİN (18.01.1485 – 06.01.1486) HADİSƏLƏRİ

### Sultan Bayəzidin Firəng diyarına qoşun göndərməsi

Bu il Sultan Bayəzid, Xadim Əli paşanı Rumeli ordusu, qapı xalqı, silahdarlar və s. izdihamlı qoşunlarla Qara Boğdan vilayətinə basqın etməyə göndərdi. Onlar o vilayəti tamamilə qarət edib qeyri-məhdud qənimətlərlə müzəffər və qalib şəkildə İstanbula qayıtdılar.

Bu il Sultan Bayəzid yaylağa çıxdı. Misir sultanının elçiləri, Engirüs padşahının elçisi və Hind padşahının elçisi gəlib, peşkəş kimi gətirdikləri töhfələri təqdim etdilər. Bir neçə gün sonra onlar izin alıb öz diyarlarına qayıtdılar.

---

[1384] Burada verilən miladi tarix çaharşənbə (çərşənbə) gününə deyil, düşənbə (bazaar ertəsi) gününə təsadüf edir.

[1385] Verilən miladi tarixi bazar gününə təsadüf edir.

## 891-Cİ İLİN (1486) HADİSƏLƏRİ

### Rumilərin misirlilərlə müharibə etməsi

Misir, Şam və Hələb diyarlarının hökmdarı olan Sultan Qayıtbay, Sultan Bayəzidin Misir diyarına qoşun çəkə biləcəyindən qorxduğu üçün özünün Təmər bəy və Özbək adlı mötəbər əmirlərini çoxlu qoşunlarla, təbillə və kosla Adana və Tarsus tərəfə göndərdi. O zaman Sultan Bayəzidin kürəkəni Fərhad bəy, Təmər bəylə Özbəyin qarşısına çıxdı. İki tərəf arasında döyüş tozu qalxdı. Misir ordusu bir anda onlara hücum edərək Fərhad bəyi və Musa bəyi qətlə yetirdi.

Bu xəbəri eşitdikdən sonra Sultan Bayəzidin qəzəb atəşi alovlandı. O, Hersekoğlunu[1386] Anadolu ordusu və Məhəmməd bəyi Rumeli ordusu ilə həmin ordunu dəf etməyə göndərdi. Adana sərhədində Özbək və Təmər bəy müzəffər qoşunla qəflətən Rum ordusu üzərinə həmlə etdilər. Ağır bir döyüş baş verdi. Anadolu ordusu müqavimət göstəməyə tab gətirməyib qaçdı. Rumeli qoşunu da vuruşub döyüşdükdən sonra qaçış yolunu tutdu.

Şeir

“Biri cövşənini atdı qaçmaq üçün,
Atəş kimi dəmirdən sıçradı tez.
Biri boz atdan, digəri kəhər atdan düşdü,
Biri nizə ilə, digəri kəməndlə”.

İgidlik meydanının atlılarından olan Hersekoğlu taleyin pəncəsində giriftar oldu (öldürüldü)[1387]. Sultan Bayəzid bu faciəli hadisəni eşitdikdə öz vəziri Davud paşanı dörd min yeniçəri, qapı xalqı, Rumeli və Anadolu qoşunu ilə o hadisəni dəf etməyə göndərdi. Davud paşa, Əli başa ilə birlikdə Geliboludan keçib çoxlu araba və zərbzən topla Adanaya yönəldi. O diyarın sərhədinə çatdıqları zaman Əlaüddövlə Zülqədər cövşən geymiş bahadırlardan [ibarət] bir dəstə ilə onlara qoşuldu və birlikdə Misir ordusuna qarşı getdilər.

Özbək və Təmər bəy həmin qoşunların gəldiyindən agah olduqda Şam tərəfə yola düşdülər. Sultan Bayəzid Misir ordusunun fərar etməsindən agah olduqda Davud paşanı və Əli bəyi geri çağırdı. Onlar geri döndülər və yol əsnasında varsaq əmirlərini dustaq edərək İstanbula gəldilər.

### Müxtəlif əhvalatlar

Bu il Sultan Bayəzid Ədirnədə qışlaq etdi. Orada Engirüs padşahının Yaqşioğlu[1388] adlı elçisi bol peşkəşlə Sultan Bayəzidin yanına gəldi. Sultan səltənət adət-ənənələrinə və dostlara mehriban davranmaq vəzifələrinə riayət edib elçiyə hər cür qayğı göstərdi. Bir müddət sonra [elçi] izin alıb öz diyarına döndü. O, Semendireyə çatdıqda, Rum camaatından biri qılıncını çəkib, kim olduğunu öyrənmədən onu atdan salaraq qətlə yetirdi. Yaqşioğlunun mülazimləri də onu parça-parça etdilər.

## 892-Cİ İLİN (28.12.1486 – 16.12.1487) HADİSƏLƏRİ

### Sultan Heydərin ikinci dəfə Çərkəz tərəfə qoşun çəkməsi

Bu il Sultan Heydər cövşən geymiş ordu ilə Ərdəbildən çıxıb Çərkəz diyarına yollandı. Din düşmənləri zəfər ənənəli qoşunun gəlişindən agah olduqda onları qorxu və dəhşət bürüdü. Onlar dağlara tərəf qaçdılar. Qazilər çoxlu əsir tutub sağ-salamat və qənimətlərlə o səfərdən qayıtdılar. Sultan Ərdəbilə qayıdıb qohumlarından və yaxınlardan olan Ərdəbil camaatına çoxlu qənimətlər bağışladı.

---

[1386] Hersekzadə Əhməd paşa *(Öztürk, şərhlər, s.581).*

[1387] Nuruosmaniyyə nüsxəsi: “Hersekoğlu və igidlik meydanının atlılarından bir çoxu taleyin pəncəsində giriftar oldular (öldürüldülər)”.

[1388] Macarıstan kralının elçisi Demetrius Yaxiç nəzərdə tutulur *(Nəvai, şərhlər, s.863).*

Bu əsnada bir gecə röya aləmində (yuxuda) gördü ki, Rəbbani arif Şeyx İbrahim Zahid Gilani[1389] [ona belə bir] xəbər verir:

- Dəniz suyunun daşması ucbatından mənim məqbərəmin məhv olması yaxındır. Özünü mənim məzarıma yetir və mənim cəsədimi o yerdən başqa bir yerə köçür!

Sultan Heydər bu əhvalatı İlahi bir işarə hesab edib, bu təxminə əsasən, özünü Şirvan məmləkətinə çatdırdı, gəmi tərtib edərək sudan keçdi və məharətli bənnalardan və peşəkar dülgərlərdən [ibarət] bir dəstəni götürüb Gilana yönəldi, tam sürətlə özünü Şeyx Zahid Gilaninin məzarına çatdırdı və həzrət şeyxin buyruğuna əməl edib o həzrətin günbəzinin və məqbərəsinin inşası ilə məşğul oldu.

## Müxtəlif əhvalatlar

Bu il Yaqub padşah, Sufi Xəlili Şiraz əmirliyindən çıxarıb, adı çəkilən şəxsin yerinə Qazı bəyi təyin etdi. Dörd aydan sonra onu da çıxardı və Mənsur bəy Pornak o vilayətdə hökumət bayrağını qaldırdı.

Bu il Təbriz şəhərində taun oldu.

Həmçinin bu il Yaqub padşah İraqa yollandı.

Yenə də bu il Sultan Hüseyn mirzə, Əmir Əmir Əlişiri Astarabada hakim göndərdi.

## 893-CÜ İLİN (17.12.1487 – 04.12.1488) HADİSƏLƏRİ

### Sultan Heydər Səfəvinin Şirvan tərəfə qoşun çəkməsi, ölümü və olumu təyin edən [Allahın] təqdiri ilə o tərifəlayiq xüsusiyyətlərə malik həzrətin şəhid olması

Bu il Sultan Heydər Səfəvi Şirvan tərəfə qoşun çəkdi. Çünki cihad etmək üçün Gürcüstana getmiş Sufi Xəlil məğlubiyyətə uğramış, çadırını və alaçığını ataraq Şirvan tərəfə getmişdi.

Bu xəbər Yaqub padşaha çatdıqda, o həzrətin yanına qasidlər göndərib xahiş etdi ki, Sufi Xəlilə kömək etsin. Ona görə də Sultan Heydər bəla kimi bir ordu ilə o diyara hərəkət etdi və Sufi Xəlilin ordugahının yaxınlığında cah-calalla yerləşdi. Sufi Xəlilin ürəyini tamamilə qorxu bürüdü və onunla görüşməyi məsləhət görmədi. Buna görə də o həzrət Şirvana yola düşdü və Kür çayı kənarında məskən saldı. Təqribən iki ay[1390] həmin yerdə qaldı və altı min nəfər səf yaran sufi onun qələbə ayətli bayraqlarının kölgəsində toplandı. O mənzildən köç edib, çaydan keçərək Şirvan tərəfə tələsdi. Mahmudabadın ətrafı qələbə şüarlı əsgərlərin dayanacaq yerinə çevrildikdə o diyarın camaatı müxaliflik etməyə başladılar. Qəhredici qəhrəman o diyarın camaatının qətlinə fərman verdi. Qısa zaman ərzində Ceyhun çayı kimi qan arxı axmağa başladı. Əcəl dəllalı kiçiyi və böyüyü, cavanı və qocanı bir qiymətə satırdı. Qəzəb atəşində kişi və qadın, varlı və yoxsul təfavütsüz yanırdı. Xülasə, o diyarda sakin qalmadı.

Beyt

“Orada adamdan nişan qalmadı,
O nahiyədə adam pəriyə (kabusa) döndü”.

O zaman şirvanşah olan Fərrux Yəsar ibn Xəlilulla bu hadisədən qorxuya düşüb, Yaqub padşahın yanına adam göndərərək bildirdi ki, “Sultan Heydər ölkə tutmaq bayraqlarını qaldırıb, zəfər əlamətli qızılbaş[1391] qoşunu ilə Şirvana gəlmişdir. Əgər o, bu məmləkəti ələ keçirsə, Azərbaycanın [digər] məmləkətlərinə də [yiyələnməyə] həvəs göstərəcəkdir. Münasib odur ki, səltənət yuvası olan astananın igidlərindən [ibarət] bir dəstəni bu dövlətsevərin köməyinə göndərəsiniz ki, mən bəndə o camaatla birlikdə qızılbaşların qarşısına çıxaraq, can alan nizə və ağır gürz işlətməklə onların qoşununun damarını qoparım”. Yaqub padşah bu xəbəri eşitdikdən sonra ordusunun sərdarlarından olan Süleyman bəy Bicəni dörd min nəfər döyüşkən süvari ilə Şir-

---

[1389] Şeyx Zahid (1218-1301) Şeyx Səfinin mürşididir. O, Lənkəranın Siyavrud kəndində doğulmuş, bir müddət Hilyəkəran (indiki Şıxakəran) kəndində yaşamışdır. Hazırda məzarı Şıxakəran kəndindədir *(V.Minorsky. A Mongol Decree of 720/1320 to the Family of Shaykh Zahid // BSOAS, London, 1954, vol. 16, part 3, p. 515-527; M.Nemət. Azərbaycanda pirlər. Bakı, 1992, s.38-40).*

[1390] Nuruosmaniyyə nüsxəsi: “on ay”.

[1391] Qızılbaşlar – Səfəvi tərəfdarı olan türk tayfalarına verilən ümumi ad. Bu tayfalar Şah İsmayılın atası Şeyx Heydər tərəfindən tərtib olunmuş 12 yarıqlı qırmızı tac qoyduqları üçün “qızılbaş” adlanmışlar. Qızılbaşlar arasında ən məşhur tayfalar şamlu, rumlu, ustaclu, təkəlü, qacar, əfşar, zülqədər, varsaq və s. idilər.

vanşaha köməyə göndərdi və adı çəkilən şəxsə (Fərruz Yəsara) Sultan Heydərlə müharibəyə icazə verən cəlbedici bir məktub (istimalətnamə) göndərdi.

Sultan Heydər cövşən geymiş qazilərlə birlikdə hərəkət bayrağını oradan Dərbəndə doğru qaldırdı. Dəmürqapı[1392] ətrafında cah-calalla dayandıqları zaman o diyarın camaatı qala hasarlarının möhkəmliyinə güvənib müxaliflik etməyə başladılar. Əzəmətli qazilər o qalanı dairə kimi əhatəyə aldılar və aləmi yandıran qoşunlar iki gün ərzində o qalanın bürclərindən birini dağıtdılar. O diyarın camaatı aman istədi. Qazilər o diyarı qarət etdilər.

Elə bu zaman Piri bəy Qacar cahanın pənahı olan dərgaha tələsib ərz etdi ki, "Yaqub padşah, Süleyman bəy Bicəni dörd min nəfərlik yaxşı silahlanmış süvari ilə Fərrux Yəsara köməyə göndərib və indi o iki sərdar döyüş atəşini alovlandıraraq hərb və savaşa hazırdırlar". Sultan Heydər bu xəbəri eşitdikdən sonra müxaliflik göstərənləri qarşılamaq üçün dönüş bayrağını qaldırdı. Onlar da yubanmadan və ləngimədən Şamaxıdan yola düşdülər. Təbərsəran[1393] nahiyəsində bir-birinə yetişdilər, səfləri qurmağa başlayaraq qılınc və nizə işlətməyə hazır vəziyyətə gəldilər. Hərb və zərb başladıqdan sonra o cah-calal meydanının atlısı (Sultan Heydər) Düldül[1394] kimi rəftar edən atını cövlana gətirib müxaliflərə həmlə etdi. Parlaq qılıncın zərbələrindən meydanın səthində qan seli axmağa başladı və can alan şölənin şimşəyindən pəhləvanlıq meydanı mənsublarının həyat xırmanını od tutdu.

Şeir

"Almaz rəngli qılıncın şaqqıltısı,
Dənizə çatdırdı qan selini.
Dəbilqə və paltar gül rənginə boyandı,
Dikbaşların ləl rəngli meyi qan oldu".

Döyüş və vuruş əsnasında Süleyman Türkman inad atını qarşıdurma meydanında cövlana gətirib, hücuma keçmək istədi. Sultan Heydər özünü ona yetirib, atəş saçan nizənin zərbəsi ilə onu izzət atından zillət torpağına saldı. Amma canına aman verdi. Təmiz qanlı və sabit qədəmli sufilərdən gurultu qopdu və o əfvin səbəbini soruşdular. Buyurdu:

- Qismət belədir ki, bir neçə gün sonra o, dünyanın çaxnaşma ilə dolu vuruşmalarında can atını axirət meydanına sürəcək. Başqa bir [səbəb] isə odur ki, bu döyüşdə mənim ruhumun süvarisi bədən atından ayrılıb səbatsız dünyanın tərəddüdlərini tərk edəcək.

Sonra yenidən düşmənləri pərən-pərən salıb özünü onların səfinə vurdu və o napak qövmdən bir çoxlarını həlak torpağı üzərinə sərdi. Az qaldı ki, atəş saçan qılıncın şimşəyindən şirvanşahın və Süleyman Türkmanın qoşununun əmin-amanlıq xırmanı yansın. Elə bu əsnada bir ox atılıb o həzrətin həyat kökünün qırılmasına səbəb oldu və o, yüksək şəhidlik dərəcəsinə ucaldı.

Məxfi qalmadı ki, ona dəymiş ox müxaliflər tərəfindən deyil, bəlkə də, Sultan Heydərin öz qoşunu tərəfdən yanlışlıqla atılmışdı. O savaşda iştirak edən bütün adamlar bəyan etmişlər ki, [həmin ox] o həzrətin əmirlərindən olan Şahsüvar Lənkəraninin[1395] atası tərəfindən atılmışdı. Pak təbiətli qazilər qüssə ilə dolu olan bu hadisənin baş verməsi üzündən qaçış yolunu tutdular.

Süleyman Bicən o həzrətin mübarək başını kəsib Yaqub padşahın yanına göndərdi. O alçağın əmri ilə həmin başı Təbriz meydanından asdılar. Bir şəxs o həzrətin başını oğurlayıb saxladı. 907-ci (1501) ildə İsgəndər şanlı xaqan (Şah İsmayıl) Təbrizi tutduqda, o şəxs həmin başı o həzrətin yanına gətirib böyük bəxşiş qazandı.

Sultan Heydərin şəhid olmasından sonra sufilər toplanaraq, İsgəndər şanlı xaqan kiçik yaşında olduğu üçün Sultan Əli padşahı xilafətə təyin etdilər. O həzrətin səltənətinin avazı iradət sahiblərinin (müridlərin) qulağına çatdıqda, özlərini darülirşad Ərdəbilə yetirib ali büsata əyilməklə iftixar və baş ucalığı əldə etdilər. Bu xəbər Yaqub padşaha çatdıqda, mülkün zavala uğrayacağından çəkinərək Ərdəbilə bir dəstə göndərdi ki,

[1392] Dəmürqapı (Dəmirqapı) – Dərbəndin türkcə adıdır.
[1393] Təbərsəran (Tabasaran) – Dağıstanın cənub-şərqində, Rubas çayı vadisində tarixi vilayət.
[1394] Düldül – Həzrət Əlinin atının adı.
[1395] Nuruosmaniyyə nüsxəsi: "Ləngərkonani". Ləngərkonan – Lənkəranın tarixi adıdır.

Həzrət Şah İsmayılı, Sultan Əli padşahı, Seyid Həsən mirzəni[1396] və onların anası Aləmşah bəyimi[1397] köçürüb İstəxr qalasına aparsınlar və Mənsur bəy Pornaka təhvil versinlər. Beləliklə, Yaqub padşahın buyruğuna uyğun olaraq, onlar həmin qalada məhbus oldular.

**Əli paşanın Misir əmirləri ilə müharibə etməsi haqqında söhbət**

Bu il Rum padşahı Sultan Bayəzid vəziri-əzəm Xadim Əli paşanı və Anadolu əmirülümərası Xəlil paşanı əzəblərdən, yeniçərilərdən və qapı xalqından [ibarət] böyük bir dəstə ilə Şam tərəfə göndərdi. Əli paşa ucsuz-bucaqsız bir ordu topladıqdan sonra döyüş alətlərini tərtib edərək, tam şövkətli bir şəkildə, ağılların və düşüncələrin dərk etmək əndazəsindən artıq olan bir qoşunla Misir və Şam diyarına hərəkət etdi. Mənzilləri və mərhələləri adladıqdan sonra Adana ətrafında dayandı, Adana qalasını və Tarsusu aldı və yeniçərilərdən [ibarət] çoxsaylı bir dəstəni o qalada qoydu. O ətrafda olan yeddi qalanı aldı.

Misir və Şam valisi Sultan Qayıtbay bu xəbəri eşitdikdə qoşunların hazır olmasına dair fərman verdi. Qısa zamanda o qədər adam Misirə üz qoydu ki, onların çoxluğundan dağ və səhra əziyyətə düçar oldu. Əvvəlki qərinələrdə və keçmiş zamanlarda Misirdə toplanmış xəzinələrin qapılarını açdı və qoşuna payladı. Özbəyi o izdihamlı orduya əmir təyin edib Rum ordusunu dəf etməyə göndərdi. Özbək yağış damcılarından və ağacların yarpaqlarından daha çox olan izdihamlı bir qoşunla Misir məmləkətindən Adana və Tarsus tərəfə yola düşdü. Onlar Rum ordusu ilə müharibə və mücadilə etməyə könül verdilər. Son dərəcə uca olması səbəbindən heç bir yaradılmışın fikir qədəminin onun zirvəsinə çata bilmədiyi və heç bir məxluqun xəyal gözünün onun yoxuşunun mislini görmədiyi bir dağı keçdilər.

Şeir

“Zirvəyə ucalan bir qaya parçası,
Fırtınadan qabarmış böyük bir dəniz kimi.
Elburz kimidir onun hər daş parçası,
Naxışlı səma kimidir onun pələngi.
Əgər bir kəs oraya yola düşsəydi,
Əcəlin əli ondan üzülərdi”.

Çay kənarına çatdıqda onu keçmək istədilər. Gəmiçilər onlara mane oldular. Bu zaman qəflətən şiddətli bir külək qalxıb onların gəmisini sındırdı və Misir ordusu özünü suya vurub keçdi.

Nəzm

“Əndişədən uzaq olan misirli süvarilər,
Qüruru adət etmiş igidlərin igidləri,
Dəryadan elə keçib getdilər ki,
Onu qurudan fərqləndirmədilər.
Dəryanı keçən atların üzəngisi,
Balığın qulağında sırğa oldu”.

Suyun kənarında ordu səfi qurdular. Əli paşa da qoşunu tərtib etməklə məşğul oldu. Səflərin tərtibindən sonra kos sədası Tarsus ətrafında qaranlıq səmaya çatdı. Savaş və döyüş dəstələrinin qalaqlanmasından, fitnə və qovğa dalğalarının təlatümündən [meydan] qalaqlanıb təlatümə düşdü. Döyüş meydanının torpağı süvarilərin və mübarizlərin beyni ilə qarışdı. Dava məkanı xəstə və ölü ürəyin qanı ilə yuyuldu. Külək ayaqlıların (külək kimi sürətli süvarilərin) tozu qara torpaqdan göy qübbəsinə qalxdı. Qanın nəmi və buxarı balığın belinə və Balıq bürcünün üzərinə çatdı. Özbək müzəffər ordu ilə bir anda Əli paşanın sağ cinahında dayanmış Qaraman qoşununa həmlə etdi. Onlar da müharibə əlini igidlik qolçağından çıxarıb müdafiə olundular. Zəfər bayraqlı igidlər əfi (ilan) əndamlı nizələrin ucu ilə Qaraman ordusunun əksərini atdan saldılar. Nizənin şöləsi Kəlimin (Musa peyğəmbərin) dilindən söz deyir, oxun qığılcımı İbrahimin atəşindən nişan verirdi.

Nəzm

[1396] Başqa qaynaqlarda bu şəxs Seyid İbrahim adı ilə məşhurdur *(Nəvai, şərhlər, s.869).*
[1397] Mətndə “Ələmşah” yazılmışdır *(Tehran çapı, s.869).*

“Oxlar ağıl kimi beyinlərdə qərar tutmuş,
Nizələr ruhlar (canlar) kimi sinələrə daxil olmuş.
Havadakı şimşək kimi qılınclar dəbilqələrə işləmiş,
Şümrün[1398] içindəki ilan kimi heybələrə girmiş nizə.
Əcəl bəndinin halqası güclülərin ayağında üzəngi,
Yoxluq torunun ipi qəhrəmanların əlində yüyən”.

Qaraman qoşununu məğlub etdilər. Anadolu ordusu da o döyüşə tab gətirməyib qaçış yolunu tutdu. Misir qoşunları Rum ordusunun sağ və sol cinahlarını önlərindən götürdükdən sonra ordugaha töküldülər və onların mallarını qarət etdilər. Qalan ərəb ordusu qəzəblə Əli paşanın arxasına keçib ona həmlə etdi. Yeniçərilər irəlidə qaldıqları üçün tüfəng atəşi açmağa fürsət tapmadılar və öz yerlərində dayandılar. Misir camaatı hiylə işlədərək, dəvələrin üzərinə bir neçə tabaq və sini başlayıb günəşin qarşısında saxladılar ki, bərq vursun. Əli paşa və Rum ordusunun əsgərləri elə təsəvvür etdilər ki, onlar yaraqlı adamlardır. Ona görə də öz yerlərindən hərəkət etmədilər.

Əli paşa qapı xalqı ilə birlikdə səhərdən axşamacan onlara müqavimət göstərdi. Gecə iki tərəf fələk şahsüvarına (günəşə) müvafiq olaraq, döyüş meydanından yüyənlərini çəkib öz ordugahlarına tələsdilər. Misir ordusu suyu keçib öz düşərgəsinə yollandı. Onlar öz ordugahlarına çatdıqları zaman orada qoyduqları adamlardan heç birini görmədilər. Çünki onlar məğlub olduqlarını təsəvvür edib hər biri bir yerə getmişdilər. Misir əmirləri pərişan hala düşüb fərar etməyi qərara aldılar. Bu əsnada bir varsaq gəlib ərz etdi ki, Əli paşa fərar etmişdir. Onlar inanmadılar və səhərə qədər at belində qaldılar. Səhər açıldıqda məlum oldu ki, Rum qoşunundan əsər-əlamət qalmamışdır. Suyu keçib Rum ordusunun düşərgəsini ələ keçirdilər. Bir neçə gün sonra Adana qalasını əhatə etdilər.

Bu tərəfdən Əli paşa Misir əmirlərinin getməsindən sonra geri çəkilməyi qənimət sayıb qaçmağa üz qoydu. Varsaq diyarına çatdıqda oranın adamları rumilərin əksərini üryan etdilər. Əli paşa pərişan və bədhal bir vəziyyətdə Eregliyə gəldi və bir neçə gün orada qaldı. O əsnada Sultan Bayəzidin tərəfindən adam gəldi və onu çağırdı. Rum ordusu pərişan və bədhal vəziyyətdə İstanbula gəldi. Misir qoşunu da qalaları tutub öz diyarına yollandı.

## Müxtəlif əhvalatlar

Bu il Yaqub padşah Təbriz dövlətxanasında yerləşən Həştbehişt (Yeddi cənnət) qəsrini tikdirdi. Yayın ortasında Səhənd yaylağına getdi. O məqamda Misir və Şam sultanı Qayıtbayın İnayət Şərbətdar adlı elçisi hüzura gəldi və əmirlərin vasitəçiliyi ilə [padşahla] görüşmək şərəfinə nail oldu. O, rumilərlə etdikləri müharibənin xəbərini ərz etdi və sultanın yazdığı məktubu təqdim etdi. Məktubun sonunda yardım istənilirdi. Qərara alındı ki, gələn il bu tərəfdən elçi göndərilsin.

Həmçinin bu il Əmir Əlişir, Əmir Bədrəddini Astarabadda qoyub Herata gəldi. Sultan Hüseyn mirzədən xahiş etdi ki, onun hüzurunda olmaq şərəfindən məhrum qalmaması üçün o vilayətin idarəçiliyini bir başqasına versin. O həzrət Əmir Əlişiri yenidən Astarabada göndərdi.

Əmir Əlişir o diyara çatdığı zaman mülazimlərindən olan Əmir Heydəri vacib bir iş üçün uca taxtın ətəyinə göndərdi. Anadangəlmə tamamən dəli olan Əmir Heydər, Sultan Hüseyn mirzəyə ərz etdi ki, “xilafətin yuvası olan astananızın mülazimləri Əmir Əlişirə zəhərli yemək verməsi üçün Kakuli Bukavulu ələ almışlar. Ona görə də [Əmir Əlişir] böyük bir qorxuya qapılaraq müxaliflik etmək fikrinə düşmüşdür”. Sultan Hüseyn mirzə bu xəbəri eşitdikdən sonra şimşək və küləklə eyni sürətdə gedən bir elçini Astarabada göndərdi və Əmir Əlişirin könlünü almaq üçün bir məktub (nişan) göndərdi. O məktubda and içdi ki, “heç vaxt belə bir şey etmək mənim fikrimdən keçməmişdir”.

Qasid, Əmir Əlişirin hüzuruna gəlib bu məktubu ona verdikdə Əlişir heyrətə düşdü. Çünki bundan xəbəri yox idi. Ondan sonra Herata yollanaraq ərz etdi ki, “Əmir Heydərin ərz etdikləri xalis yalandır və heç vaxt bu cür söz mənim qulağıma çatmamışdır”. Ona görə də Əmir Heydər həbs edildi. Əmir Əlişir isə əmirliyi (hakimliyi) tərk edib padşahın həmdəmi oldu.

[1398] Şümr – İmam Hüseyni qətlə yetirən şəxsdir.

Bu il İbn Hüsam [adı] ilə məşhur olan Mövlana Məhəmməd susqunluq möhürünü dodağına vurdu (öldü). Mənzum əsərləri arasında “Şahnamə” vəznində olan “Xavərnamə” kitabı vardır.

## 894-CÜ İLİN (05.12.1488 – 24.11.1489) HADİSƏLƏRİ

### Rum padşahının Əlaüddövlə Zülqədərə məğlub olması

Bu il Rum padşahı Sultan Bayəzid, Zülqədəroğlu Budaq bəyi, Rumeli əmirülümərası Məhəmməd paşanı və Mixaloğlu İsgəndər bəyi böyük bir ordu ilə Əlaüddövlə Zülqədərin üzərinə göndərdi. Onlar o tərəfə tələsərək qəfildən Şahrux bəy Zülqədərin[1399] üzərinə töküldülər və onu ələ keçirib, cahanı görən gözünü əşya görməkdən məhrum etdilər (kor etdilər).

Bu möhnətli xəbər Əlaüddövlə Zülqədərə çatdıqda, Əlbistan və Mərəş qoşununu toplayıb o tərəfə doğru hərəkətə gəldi. Rum ordusu da onu qarşıdı. Mövqelərdən bir mövqedə o iki qiyamət əlamətli qoşun bahar buludu kimi coşub gurlayaraq bir-birinə yetişdilər və həmlə küləyi ilə döyüş atəşini alovlandırdılar. Döyüşdən və vuruşdan sonra Rum ordusu məğlub oldu. Zülqədərlər onları təqib edib Mixaloğlu İsgəndər bəyi onların bir dəstəsi ilə birlikdə əsir etdilər. Budaq bəy isə kiçik bir dəstə ilə İstanbula gəldi. Əlaüddövlə, İsgəndər bəyi Misirə göndərdi.

Bu xəbər Rum diyarına çatdıqda o diyarın cammatı çaş-baş və mat-məəttəl qaldılar və Əlaüddövlənin Rum şəhərlərini qarət etmək iradəsi göstərəcəyindən qorxdular. Lakin [Əlaüddövlə] belə bir hərəkət etməkdən vaz keçib öz yerindən tərpənmədi.

### Müxtəlif əhvalatlar

Bu il Yaqub padşah, Qazı İsa Sədrin qardaşı Qazı Şeyx Əlini İraq məmləkətini təftiş etməyə göndərdi. Adı çəkilən şəxs təqribən yeddi ay İraqda qalıb bütün mahalı bərqərar etdi.

Həmçinin bu il Şirvan padşahı Fərrux Yəsar, Yaqub padşahın dərgahına bacarıqlı elçilər göndərdi və şərtnamə təqdim etdi. Surəti budur: “Tələbkar, müdrik, həlak edən və daim var olan, yatmayan və ölməyən Uca Allaha və müvəqqəti olmayan əzəmətli, qədim “Quran”a and içirəm ki, ömrüm boyu əlahəzrət xaqan Əbülmüzəffər Sultan Yaqub Bahadur xanın dostuna dost, düşməninə düşmən olacağam. Rəiyyətpərvərlik və ədalət göstərmək istiqamətində o həzrətin düzgün üslubuna və doğru yoluna riayət edəcəyəm. Əlahəzrətin naiblərinə [verməyi] qəbul etdiyim beş min Təbriz tüməni ndə məbləği ödəməkdə ləngiməyə və səhlənkarlığa qətiyyən yol verməyəcəyəm. Bu əyyamda atamla ittifaq (əməkdaşlıq) etmiş Şirvan məmləkətinin əmirlərini, dövlət ərkanını, adlı-sanlı hakimlərini, əyanlarını və məşhurlarını əlahəzrətin naibləri tərəfindən izin və rüxsət olmadan cəzalandırmayacağam, qətlə yetirməyəcəyəm və qarət etməyəcəyəm. Səadətli xaqan Əmir Teymurun qaydasınca, o həzrətin çağırışına və yasağına[1400] hazır olacağam, haraya əmr etsə, qoşun göndərəcəyəm və heç bir bəhanə və üzrxahlıqla boyun qaçırmayacağam. Qədim dostları əlahəzrətin naibləri ilə dostluğa bərabər tutmayacağam və əlahəzrətə dostluq və xidmət etməyi onlardan üstün biləcəyəm. Ümumən dövlət işində ortaya çıxan hər məsələni naiblərinizdən məxfi və gizli saxlamayacağam və ərz edəcəyəm. Bu qaydada iltizam və öhdəlik qəbul edirəm. Əgər, Allah eləməmiş, bu işlərin hamısından və ya bəzisindən boyun qaçırsam və inad göstərsəm, Uca və Şanlı Allahın himayəsindən və Allahın elçisinin yolundan çıxmış olaram və İlahi qəzəbə və hiddətə və padşahın qəhrinə layiq olaram”.

## 895-Cİ İLİN (25.11.1489 – 13.11.1490) HADİSƏLƏRİ

Bu il Misir padşahı böyük bir ordunu qəzəb və kinlə Qaraman vilayətinə basqın etməyə göndərdi. Onlar o sərhədə çatdıqda, məkr və hiylə üzündən Sultan Bayəzidə elçi göndərib sülhdən söz açdılar. Sultan

[1399] Şahrux bəy – Əlaüddövlə Zülqədərin oğlu idi.

[1400] Yasaq – burada hərbi əməliyyatlarda, müharibədə iştirak etmək üçün əyalətlərdəki qoşunların təyin olunmuş yerə gəlmələri mənasında işlədilmiş termindir. Hərbi toplanış mənasını verir. Ümumiyyətlə, qədim türk sözü olan yasaq bir neçə məna verir: qayda-qanun, cəza, əmr, səfərbərlik və ya hərbi toplanış, nizam-intizam, mühafizə dəstəsi (bax: *H.H.Zərinəzadə. Fars dilində Azərbaycan sözləri, s.398*). Müasir türk dilində qadağa mənasında da işlədilir.

Bayəzid onların sözlərinə aldanıb İstanbuldan çıxmadı və Misir ordusu Qaraman vilayətinə basqın edib istila bayrağını qaldırdı.

Beyt

"Hər tərəfdən mal-dövlət tarac etmək üçün,
Sitəm qartalları qanad açdılar".

Bu xəbər Sultan Bayəzidə çatdıqda, suyu keçmək üçün Beşikdaşa gəldi. Əmirlər ərz etdilər ki, "hal-hazırda Şam tərəfə getmək dövlətin xeyrinə deyildir, çünki o hüdudda bahalıq baş qaldırıb və qış yaxındır". O əsnada xəbər gəldi ki, Misir qoşunları geri dönmüşlər. Sultan Bayəzid Ədirnəyə yollandı. Çünki İstanbulda taun baş qaldırmışdı.

### Müxtəlif əhvalatlar

Bu il şəvval ayında (18.08-15.09.1490) İstanbulda Topxananın güngörməzini (günbəzini?) ildırım vurdu, orada toplanmış çoxlu barıta od düşdü və günbəzin hissələrini bir-birindən ayırıb, üç məhəlləni dağıtdı (xarab etdi).

Bu il Sultan Hüseyn mirzə tərəfindən Astarabad hakimi olan Əmir Moğol nəfsani hisslərə qapılıb, üsyan və itaətsizlik sarığını alnına bağlayaraq Xoca Məhəmməd Bitikçini həbs etdi və Seyid Kəmaləddin Əcəli şəhidlik dərəcəsnə çatdırıb İraqa yönəldi. Bir müddət sonra o, Sufi Xəlilin fərmanı ilə öldürüldü[1401].

Bu il Yaqub padşah Qarabağda qışlaq etdi. Təbrizdə taun baş qaldırdı.

## 896-CI İLİN (14.11.1490 – 03.11.1491) HADİSƏLƏRİ

### Yaqub padşahın ölümü, Mirzə Baysunqurun səltənəti və Bayandur əmirlərindən bir çoxlarının öldürülməsi

Bu il Yaqub padşah ibn Həsən padşah ibn Əli bəy ibn Osman bəy ibn Qutluq bəy ibn Turəli bəy ibn Pəhləvan bəy, Sultani qışlağında[1402] fani dünyadan ədəbi aləmə köçdü.

Onun ölümünün səbəbi budur ki, anası Səlcuqşah bəyim, Həsən padşahın oğlu Məsih mirzəni zəhərləmək istəyirdi. Bu niyyətlə suya salınmış qaysının olduğu qaba zəhər qatdı. Yaqub padşah hamamdan çıxıb qardaşı Yusif bəylə birlikdə onu yedilər. Bu əsnada Səlcuqşah xanım də xəbərdar olub, təsadüf üzündən o da həmin qaysıdan yedi və ondan sonra böyürlərini xəstəlik yatağına qoydular. Yusif bəy və Səlcuqşah xanım vəfat etdilər. Sözügedən ilin səfər ayının 11-də (24.12.1490) Yaqub padşah da dünyadan köçdü. Ömrü iyirmi səkkiz il, səltənət əyyamı isə on iki il və iki ay olmuşdur.

Şair Mövlana Bənnai[1403] bu hadisə barədə demişdir:

Şeir

"Nə Yusifdən nişan gördüm, nə Yaqubdan bər əsər-əlamət[1404],
Ey əzizlər, əgər Yusif itdisə, bəs, Yaquba nə oldu barı?
Yenidən, ey fələk, aləmin əhvalını dəyişdin,
Səni görüm alt-üst olasan ki, dünyanı alt-üst etdin.
Amansızlığın üzündən Yusiflə Yaqubu birgə,
Sən, ey qaniçən canavar, axırda qəribə bir şəkildə apardın".

---

[1401] Əmir Moğol h. 896 / m. 1491-ci ildə, Sultan Yaqubun oğlu Baysunqurun hakimiyyəti dövründə Azərbaycana gəlmiş və burada da siyasi oyunlarını davam etdirdiyi üçün Sufi Xəlil tərəfindən öldürülmüşdü *(Nəvai, şərhlər, s.878).*

[1402] Sultani (Sultanbud) qışlağı – Qarabağda, Bərdə ilə Ağdam arasında yerləşir (*Фазлуллах ибн-Рузбихан Хунджи. Тарих-и алам ара-йи Амини, с.142)*.

[1403] Heratlı şair Kəmaləddin Şirəli Bənnai (1453-1512) bir müddət Sultan Yaqubun xidmətində olmuş, Azərbaycanda yaşamış, Sultan Yaquba və Şirvanşah Fərrux Yəsara qəsidələr həsr etmişdir *(Z.Safa. Banâ'î Heravî // Encyclopaedia Iranica, vol. III, New York,1989).*

[1404] Bu şeirdə Ağqoyunlu hökmdarı Yaqubun və onun qardaşı Yusifin adı ilə Yaqub peyğəmbər və onun oğlu Yusif peyğəmbərin adı arasında paralel aparılmışdır.

Onun zamanında xəraclar qapısı bağlı idi və həqiqi (qanuni) vergini ödəməkdən savayı heç nə tələb olunmurdu. Şeir və şairlik tamamilə rəvac tapmışdı. Məmləkəti İraqi-Ərəb, İraqi-Əcəm, Fars, Azərbaycan və Diyarbəkr idi. Mövlana Cami demişdir:

Şeir

"Həsənin oğlu Yaqubun şahlığı,
Lap asimandakı ay kimi idi.
Rumdan Xorasana qədər mülkü vardı,
Və pisliklərdən ürəyini uzaq tutardı".

Şirvan padşahı da hər il [ona] xərac kimi beş min tümən verirdi. Təbriz dövlətxanasında yerləşən Həştbehişt imarəti onun yadigarlarındandır. O cənnət nişanlı məkanın ətrafından behişt bağının ətri gəlir.

Beyt

"Pəncərələrindən bəxt nuru parlamaqda,
Qapılarından rəhmət qasidi tələsməkdə".

İşrətabad və Şimal bağları da onun yadigarıdır ki, havasının gözəlliyi və bağçalarının çoxluğu ilə seçkin və müstəsnadırlar.

Beyt

"Onun suyu Kövsəri utandırır,
Ağaclarının hamısı Tuba kimidir".

Qazı Əlaəddin, Sultan Yaqubun [ölüm] hadisəsi haqqında demişdir:

Şeir

"Keçən gecə yuxuda gördüm yəqinlik üzündən,
Cənnət bağında Yusif və Yaqub yanaşıdır.
Hər ikisinin vəfat tarixini soruşdum,
Dedi ki, nə deyim, "Xüldi-bərin"dən savayı?!"[1405]

Yaqub padşahın ölümündən sonra Sufi Xəlil Mosullu, Yaqub padşahın böyük oğlu Baysunqur mirzəni səltənətə yüksəltdi və bütün işləri öz əlinə aldı. Çünki Yaqub padşah xəstə olduğu vaxt oğlu Baysunqur mirzəni Sufi Xəlilə tapşırmışdı. Padşahın ölümündən sonra Sufi Xəlil, Bayandur əmirlərini çağırıb dedi:

- Əgər padşah dünyadan köçsə, illərlə belə bir fürsəti gözləyən həsədçilər və qəsdçilər bu diyara qəsd edəcəklər.

Onlar dedilər:

- Siz nəyi məsləhət görsəniz, ondan boyun qaçırmayacağıq.

Əmir Xəlil dedi:

- Padşah fani dünyadan əbədiyyət mülkünə köçmüşdür. İndi gərək Baysunqur mirzənin səltənətini qəbul edək[1406].

Bütün əmirlər onun bu sözünə tabe oldular. Əhd-peyman bağladıqdan sonra Baysunqur mirzəni padşahlıq taxtına oturtdular. Baysunqur mirzə məmləkət işlərini Sufi Xəlilə həvalə etdi.

Bayandur əmirləri öz çadırlarına getdikdə şərab içməklə məşğul oldular. Sərxoşluq onlara qalib gəldikdə padşaha və Sufi Xəlilə qarşı çıxmaqda əlbir oldular. Bu vaxt gecələrdən bir gecə bir qadın gəlib, əlindəki örpəyi əmirlərin önünə qoyaraq dedi:

- Siz Sufi Xəlilin qorxusundan Baysunqurun səltənətinə razı oldunuz.

Onların qeyrət damarı hərəkətə gəldi, döyüşə və vuruşa hazırlaşdılar.

Nəzm

"Bir araqarışdıran fitnəkar ucbatından,
Yetərincə fitnə qalxdı hər kənardan.
Minlərlə fədai cuşa gəldi,
Coşqun sel kimi gurlamağa başladılar.

[1405] "Xüldi bərin" ("cənnət, behişt" deməkdir) = 896 h.

[1406] Nuruosmaniyyə nüsxəsinin bu yerində, aşağıdakı cümləyə yer verilmişdir: "Bu əsnada Məsih mirzə edi: Biz Baysunquru səltənətə qəbul edirik".

Dedilər birlikdə uca bir səslə,
Zülmkar canavara nə qədər dözək?”

Sultan yurdunda olan Sultan Xəlilin oğlu Mirzə Əli ilə birlikdə Bayandur camaatı Həsən bəyin oğlu Məsih mirzəni padşahlığa yüksəltdilər. Sufi Xəlil, mosullu əmirləri ilə birlikdə döyüşə başladı. Mirzə Məsihin qoşununun igidləri Sufi Xəlilin cağ və sol cinahlarını bir-birinə qatdılar. Sufi Xəlil Ulu Rəbbin köməyi ilə onları yerindən dəbərdib özünü Məsih mirzəyə yetirdi. Əbdülbaqi mirzə Miranşahi[1407], Sufi Xəlilin başına bir qılınc vurdu. Lakin sarığının içində zəncir olduğu üçün işə yaramadı. Sufi Xəlil Tanrının köməyi ilə Məsih mirzəyə zərbə vurub onu izzət atından zillət torpağına sərdi. İti qılıncla onun qalmaqalla dolu başını bədənindən ayırdı. Əbdülbaqi mirzə əsir alındı, amma onun canına aman verildi.

Sufi Xəlil, Mirzə Qəzənfər Miranşahini və Zəngişah bəy Pərvanəçini məşəlin altında qətlə yetirdi. Rüstəm bəy ibn Maqsud bəy ibn Həsən padşahı tutub Əlincəq qalasına məhbus etdi. Mahmud bəy ibn Uğurlu Məhəmməd ibn Həsən padşah bu döyüşdən fərar edib Həmədanda Şahəli bəy Pornaka qoşuldu.

Baysunqur mirzə və Sufi Xəlil çoxlu qoşunla onların üzərinə getdilər. Dərcəzin hüdudunda Dang ribatında hiddət və kinlə dolu olan o iki ordu bir-biri ilə müharibə etdilər. Baysunqur mirzə mərkəzdə qərar tutdu. Sufi Xəlil və Qayıtmış bəy Bayandur cəsarətli igidlərdən [ibarət] bir dəstə ilə müxaliflərə həmlə etdilər. Mahmud bəy qələbəyə iddialı qoşunlarla birlikdə Baysunqur mirzənin mərkəzinə hücum edib onları Binatünnəş[1408] [ulduzları] kimi pərən-pərən saldı. Sufi Xəlil tuğu aşağı saldı. Şahəli bəy Pornak, Sufi Xəlilə həmlə etdi. Əbdülbaqi mirzə qələbə bayraqlı bahadırlar dəstəsi ilə birlikdə döyüşə atıldı. Savaş və vuruş əsnasında Şahəli bəy ölüm şərbətini içdi. Ona görə də Mahmud bəyin qolu-qanadı qırıldı. O, talesiz üzünü qaçış vadisinə çevirib, vahiməsinin və qorxusunun çoxluğundan bir dəyirmana pənah apardı. O həndəvərdə olan Seyid Nemətulla Həmədani vəziyyətdən xəbərdar olub onun həyatının dənəsini üyütməyə (un etməyə) yönəldi. O, qəflətən dəyirmanın ətrafını tutub, Mahmud bəyi ələ keçirərək Baysunqur mirzənin yanına apardı və [Mahmud bəy] onun fərmanı ilə öldürüldü.

Mahmud bəyin qətlindən sonra Yusif bəy Bayandur və Qayıtmış bəyin [oğlu] Abbas bəyin oğulları Baysunqur mirzənin hüzuruna gəlib hörmətlə qarşılandılar. Fərmana görə, böyük bir ordu ilə Qəzvinə gəlib kiçiklərdən və böyüklərdən çoxlu mallar aldılar.

O zaman Mir Məlik Seyfi, Gilan valisi Karkiya Mirzə Əlinin fərmanına əsasən, igidlərdən [ibarət] bir dəstə ilə qəfil bəla kimi türkmanların üzərinə tökülüşüb, Budaq bəy Hüseynhacılunu qətlə yetirərək Gilana yollandı.

Mirzə Baysunqur düşmənləri dəf etməkdən asudə olduqdan sonra əmirülüməralıq mənsəbini Fərrux bəyə[1409] lütf etdi və Şeyx Məhəmməd Keçəçini vəzir [təyin] etdi.

Beyt

“Qaldırdı zəmanədən əyri işi,
Xoca Keçəçinin doğru işi”.

Və bu Məhəmməd Keçəçi camaatı Rüstəm bəyə tərəfdar olmağa rəğbətləndirdi[1410].

Elə həmin vaxt Rum padşahı Sultan Bayəzid halını soruşmaq üçün Baysunqur mirzəyə bir elçi göndərdi və bəlağətli bir məktub yolladı. Baysunqur mirzə elçini tam izzət və ikramla Rum diyarına yola saldı.

Yaqub padşahın ölüm xəbəri Şiraza çatdıqda, Mənsur bəy Pornak sözügedən ilin səfər ayında (14.12.1490 – 11.01.1491) Qazı İsanın qohumlarından olan Qazı Şeyx Əlini və Xoca Fəxrəddin Əbdülməlik Savəcini tutub onların mallarını qarət etdi, sabiq zamanda yöndəmsiz əməllər törətmiş adamların bir qismini qətlə yetirdi və Baysunqurun adına sikkə vurdu. Bir neçə gün sonra xəbər gəldi ki, Şahəli bəy Pornak qorxmaz adamlardan [ibarət] bir dəstə ilə Mahmud bəyi səltənətə yüksəldərək İraqa yönəlmişdir.

---

[1407] Bu şəxs Əmir Teymurun oğlu Miranşahın nəslindəndir: Əbdülbaqi ibn Osman ibn Seydi Əhməd ibn Miranşah ibn Teymur. O, Şah İsmayıl hakimiyyətə gəldikdən sonra Xorasana qaçıb Sultan Hüseyn Bayqaraya sığınmış, onun qızı Sultanımla evlənmiş və h. 911 / m. 1505-06-cı ildə Səbzəvarda özbəklərə qarşı döyüşdə öldürülmüşdür *(Nəvai, şərhlər, s.884).*

[1408] Binatünnəş – Böyük və Kiçik Ayı bürclərinin ulduzları. Klassik Şərq ədəbiyyatında bir sıra hallarda dağınıqlıq, pərakəndəlik rəmzi kimi işlədilmişdir.

[1409] Nuruosmaniyyə nüsxəsi: “Qoç bəy”.

[1410] Nuruosmaniyyə nüsxəsi: “Şeyx Məhəmməd Keçəçi əmirlərin yanında Rüstəm bəyin səltənətə gətirilməsi barədə təbliğat aparırdı”.

O əsnada Şahəli bəyin mülazimi Şiraza çatıb yardım istədi. Pornak tayfasına bağlı olduğu üçün xütbəni Mahmud bəyin adına oxudular. [Mənsur bəy Pornak] Cahangir bəy Xocahacılunu və Sultan Əhməd bəy Cövlanini igidlərdən [ibarət] bir dəstə ilə Mahmud bəyə köməyə göndərdi. Onlar yolda ikən Mahmud bəyin qətli xəbərini eşidib Şiraz tərəfə geri döndülər.

O əsnada Sufi Xəlil Şiraza fəthnamə göndərdi. Mənsur bəy yenidən xütbədə Mirzə Baysunqurun ləqəblərini oxutdurdu. Qayıtmış bəy Bayandur Yəzddə Mirzə Baysunqura qarşı müxaliflik etdiyi üçün Mirzə Baysunqur hökm göndərib Mənsur bəyə onunla vuruşmağı əmr etdi. Həmin fərmana əsasən, Mənsur bəy, Sultan Əhməd bəyi və Qasım bəy Cövlanı igidlərdən [ibarət] bir dəstə ilə Yəzdə yolladı ki, onunla vuruşsunlar. Yəzd ətrafında böyük bir döyüş baş verdi. Axırda Mənsur bəy, Qayıtmış bəyi öldürüb başını dərgaha göndərdi.

Vəkilliyin[1411] cilovu Sufi Xəlilin əlində qərar tutduğu üçün o, ixtiyar yüyənini tamahkar nəfsin əlinə verib, ipə-sapa yatmayan dikbaşlıq təbiətini hər tərəfdən cövlana gətirdi. Axırda əmirləri, qəbilələri və əsgərləri özündən narazı saldı və hamısı ondan üz döndərdi. Çünki o, qəbahətli əməllər törətmişdi. Ağqoyunlu sərdarlarının bəziləri fərar etdilər. Süleyman bəy Bicən düşmən qıran bahadırlardan [ibarət] bir dəstə ilə Diyarbəkrdən Təbrizə hərəkət etdi. Sufi Xəlil və Mirzə Baysunqur cəsur adamlardan [ibarət] bir dəstə ilə Süleyman bəyi qarşılamağa çıxdılar. Mənzilləri adladıqdan sonra Van hüdudunda onlar Süleyman Türkmana yetişdilər və hər iki tərəfdən səf quruldu. Əclaf Süleyman o qoşunların qorxusundan dəvələri yerə yatırıb dəvələrin arasında gizləndi. Baysunqur mirzə və Sufi Xəlil döyüşə başladılar.

Çalışma və vuruşma zamanı əsr vaxtına qədər davam etdiyindən, Sufi Xəlilin mülazimləri taqətsiz və zəlil oldular. Süleyman bəy az adamla çıxıb onlara həmlə etdi. Əmirlərin bəzisi vəfasızlıq yolunu tutub Baysunqur mirzəni Süleyman bəyin yanına apardılar. Sufi Xəlil məğlub oldu və onun oğlu bu aralıqda öldü. O, Süleyman bəyin yanına gəlmədi. Süleyman bəy ondan sonra ixtiyar sahibi olub Baysunqur mirzə ilə birlikdə Təbrizə gəldilər və o şəhərdə yerləşdilər.

Fəzilət xüsusiyyəti ilə tanınan və padşaha yaxınlığı ilə məşhur olan Qazı İsa Savəci[1412] bu il Sufi Xəlilin fərmanı ilə qətlə yetirildi.

## 897-Cİ İLİN (04.11.1491 – 22.10.1492) HADİSƏLƏRİ HAQQINDA

### Rüstəm padşahın səltənəti, Həzrət Şah İsmayılla Sultan Əli padşahın [həbsdən] çıxması, onların Baysunqur mirzə ilə müharibə etməsi və Mirzə Baysunqurun öldürülməsi haqqında

Bu il Aybə sultan Bayandur qacar qoşunu ilə birlikdə Qarabağdan Əlincəqə hərəkət edib, qala hakimi Qırıq[1413] Seyid Əlini özünə müttəfiq edərək Rüstəm bəyi həbsdən çıxardı və Təbrizə yönəldi.

Süleyman bəy və Baysunqur mirzə bu xəbəri eşitdikdə [onları] qarşılamağa tələsdilər. Amma kimi qaravulluq etməyə göndərdilərsə, onlara qoşuldu. Qoşunun müxalifliyi ucbatından Baysunqur mirzə, Şeyx Nəcmlə[1414] birlikdə Şirvan tərəfə fərar etdi. Süleyman bəy də Diyarbəkr tərəfə qaçdı[1415]. Rüstəm bəy Təbrizə yönəlib sultan taxtında qərar tutdu.

Mirzə Baysunqur Şirvana çatdıqda, Şirvan padşahı Fərrux Yəsar igidlərdən on iki min nəfəri ona qoşub Azərbaycan tərəfə yolladı[1416]. Bu xəbər Rüstəm padşaha çatdıqda belə qərara aldı ki, Sultan Əli padşahı və İsgəndər şanlı xaqanı (Şah İsmayılı) Aybə sultanla birlikdə Şirvan tərəfə göndərsin və o xanədanın (Səfəvilərin) sufiləri və müridləri toplaşıb Baysunqur mirzənin həyat damarını qoparsınlar. Baysunqur mirzənin hərəkətə keçdiyi bəlli olduqda, o, ali əsilli və ulu nəsilli şahzadələri qaladan çıxarıb Təbrizə çağırdı, onların yanına çoxlu nağd pul göndərdi və Şirvan yürüşünə hazırlaşmalarını istədi.

---

[1411] Vəkil – şahdan sonra ikinci şəxs hesab olunurdu. Səfəvilər dövründə o, mahiyyət etibarilə şahın dünyəvi və dini cəhətdən müavini idi *(R.M.Savory. The Principial Offices of the Safavid State during the Reign of Ismail I // BSOAS, London, 1960, vol. 23, p.94; О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.252).*

[1412] Yəni vəzir Xoca Şükrullanın oğlu Qazı Məsihəddin İsa Savəci. O, Sultan Yaqub dövründə sədarət mənsəbinin və şəriət işləri kürsüsünün sahibi idi *(Nəvai, şərhlər, s.887).*

[1413] Nuruosmaniyyə nüsxəsi: "Qazaq".

[1414] Şeyx Nəcməddin Məsud *(Nəvai, şərhlər, s.888).*

[1415] Orada hamamda ikən öz düşmənləri tərəfindən öldürüldü *(Nəvai, şərhlər, s.888).*

[1416] Baysunqur – Şirvanşah Fərrux Yəsarın qızının oğlu idi.

Bu xəbər ətrafa çatdıqda, qısa zamanda Rum və Şam sufilərindən on iki min süvari qələbə ayətli bayraqların kölgəsində toplaşdı. Ondan sonra Aybə sultanla birlikdə Mirzə Baysunquru və Şirvan padşahını dəf etməyə yönəldilər. Kür çayı kənarına çatdıqda orada yerbəyer oldular. O tərəfdən də Mirzə Baysunqur cəsur adamlardan [ibarət] bir dəstə ilə onların [çayı] keçməyinə mane oldu. Lakin o, "vilayət"in pənahı olan qoşunun çoxluğundan agah olub bildi ki, qarşıdurmanın faydası yoxdur və əməlindən peşman olub Şamaxı tərəfə döndü. Aybə sultanla Sultan Əli padşah da Təbriz tərəfə qayıtdılar.

O əsnada xəbər çatdı ki, İsfahan hakimi Kosa Hacı Bayandur yağı olub (qiyam edib) Mirzə Baysunqurun adına xütbə oxutmuşdur və bu yardımın təsiri ilə mirzə Şirvandan hərəkətə gəlib Meşkinin Əhərində[1417] dayanmışdır.

Rüstəm bəy özünü iki tərəfdən müxaliflərin oxlarının hədəfində gördü. O, yenidən Sultan Əli padşahdan xahiş etdi ki, Aybə sultanla bərabər qiyamçıları dəf etməyə yollansın. O həzrət bu mübarizəni qəbul edib, on iki min nəfərlə həmin döyüşə əzm edib yola düşdü. Həmin gün Qara Piri Tuğaçı, Kosa Hacı ilə müharibəyə yollandı.

Sultan Əli padşah və Aybə sultan, Mirzə Baysunqura yetişdilər. İki tərəfdən hərb səfləri quruldu. Döyüş və vuruş atəşi alovlandı.

Beyt

"Elə ki bir-birinə nəzər saldılar,
Bir anda əl-qol açdılar.
Bir-birinin üstünə at çapdılar,
Asayiş birdəfəlik aradan qalxdı.
Vuruşaraq kükrəməyə başladılar,
Qülzüm girdabı kimi cuşa gəldilər".

Firəng cövşənlərinin üzü ox atışlarından Davudi zirehə[1418] döndü və Davudi zirehin halqaları ağır gürz zərbələrindən kiçik dənəciklərə bölündü.

Nəzm

"Tikan qanadlı oxdan, gürzdən və şeşpərdən,
Qalxanlar zireh kimi, dəbilqələr bəktər[1419] kimi.
Nizə fikir kimi canda yer tutmuş,
Ox nur kimi gözdə oturmuş".

Sultan Əli padşah dövlətsevər qazilərlə azğınların qoşunundan iki min[1420] nəfəri qətlə yetirdi. Aybə sultan digər bir tərəfdən cövşən geymiş igidlərdən [ibarət] bir dəstə ilə döyüş atəşini alovlandırıb, müxaliflərin ömür xırmanını yandıraraq yoxluq küləyinə verdi. Mirzə Baysunquri mühasirəyə alsalar da, aradan çıxıb qaçdı. Bir neçə gün sonra Seyid Əli Pornak onu tutdu. Bu hadisə çaharşənbə günü, şaban [ayının] 7-də (04.06.1492)[1421] baş verdi. Sözügedən ayın 16-da (13.06.1492) onu Təbrizə gətirdilər və mübarək ramazan ayının 17-də (13.07.1492), şənbə gecəsi[1422] Səhənd dağında öldürüldü. O tərəfdən Qara Piri Tuğaçı Dərcəzin ətrafında Kosa Hacını qətlə yetirib, başını dərgaha göndərdi. Xoş təsadüflərdəndir ki, bu iki qələbənin xəbəri eyni gecədə Rüstəm padşaha çatdı. Şair Şəhidi həmin hadisə haqqında demişdir:

Beyt

"Ey şah, Quma əzm etdin və digər bir qələbə qazandın,
Hacının boynunu vurdun və Kəbəyə (məqsədinə) yetişdin".

---

[1417] Meşkin – Cənubi Azərbaycanda, Ərdəbildən şimal-qərbdə, Ərdəbillə Əhər arasında yerləşən tarixi vilayət. Mərkəzi şəhəri Xiyav (indiki Meşkin şəhəri) idi. Əhər – Cənubi Azərbaycanda, Təbrizdən 95 km. şimal-şərqdə, Əhər çayı sahilində, dağ ətəyində yerləşən şəhər. Qaradağ vilayətinin əsas şəhəridir.

[1418] M.ö. 1000-965-ci illərdə hökmranlıq etmiş Davud peyğəmbər Süleyman peyğəmbərin atasıdır. Davud peyğəmbər dəmir məftildən zirehli geyim toxumaqda ən istedadlı şəxs hesab olunurmuş. Onun bu bacarığı Şərq ədəbiyyatında mədh edilmişdir.

[1419] Bəktər – türkcədir. Döyüş libası növlərindən birini bildirir. Bir-birinə birləşdirilmiş dəmir lövhələrdən ibarət olub, üzərinə məxmər, zərbafta və s. kimi parçalar çəkilərdi *(M.Müin. Fərhəngi-farsi. I. c. Tehran, 1342, s.558).*

[1420] Paris nüsxəsi: "on min".

[1421] Verilən miladi tarix düşənbə (bazar ertəsi) gününə təsadüf edir.

[1422] Verilən miladi tarix cümə gününə təsadüf edir.

Bu il Rüstəm bəy ali mənşəli şahzadələri darülirşad Ərdəbilə göndərdi ki, əvvəlki qaydada orada qalsınlar və xalqı zəlalətdən hidayətə irşad etsinlər (yanlış yoldan doğru yola yönəltsinlər). Rüstəm bəyin icazəsinə əsasən, onlar Ərdəbili hidayət nurlarının şəfəqi ilə cənnət bağının həsəd apardığı yerə çevirdilər.

İradət əhlinin (müridlərin) fələk qədər uca məqamlı şahzadələrin başına izdihamlı bir şəkildə toplanmasının xəbəri Rüstəm bəyə çatdıqda, o, qorxu-hürküyə qapılıb, öz mülkünün zavala uğrayacağından ehtiyat edərək yüksək şanlı şahzadələri çağırmaq üçün adam göndərdi, İsgəndər şanlı xaqanı qardaşları ilə birlikdə öz ordusuna gətirdi və əmr etdi ki, sufilərdən qətiyyən heç biri onların xidmətində (yanında) olmasın. Həmin il Xoyda qışlaq etdi.

## 898-Cİ İLİN (23.10.1492 – 11.10.1493) HADİSƏLƏRİ

### Dərviş Əli Kitabdarın Sultan Hüseyn Bayqaraya qarşı müxaliflik etməsi

Bu il Sultan Hüseyn mirzə tərəfindən Bəlx hakimi olan Əmir Əlişirin qardaşı Dərviş Əli Kitabdar müxaliflik izhar edib, o diyarda olan İbrahim Hüseyn mirzəni [oradan] çıxardı və Bədəxşan hakimi olan Sultan Əbu-Səid oğlu Sultan Mahmud mirzənin yanına elçilər göndərib özünü onun tərəfdarları sırasına daxil etdi.

Sultan Hüseyn mirzə istədi ki, onunla Sultan Mahmud mirzə arasında dostluq münasibəti möhkəmlənmədən öncə onu dəf etməyə çalışsın. Əmirlərin bəzisi ərz etdilər ki, "Dərviş Əlinin müxalifliyi Əmir Əlişirin razılığı olmadan baş qaldırmamışdır". Ona görə də o həzrət, Əmir Əlişirdən inciyib, ondan sonra bəla kimi təsirli bir ordunu Bəlxə yolladı. Dərgaha yaxın adamlardan olan Xoca Qiyasəddin Məhəmməd Dehdar Bəlxə gedib, Dərviş Əlini o həzrətin cəzasına məruz qalmayacağı barədə əmin edərək onu Təxti-Xatunda hökmdar ordusuna gətirdi. Sultan Hüseyn mirzə onun günahından keçib, Bəlx ətrafında dayanaraq o bölgədə qışlaq etdi.

### Sultan Hüseyn mirzənin Sultan Mahmud mirzənin məmləkətini ələ keçirmək üçün hərəkət etməsi haqqında söhbət

Bu il Sultan Hüseyn mirzə, Əmir Əlişiri Bəlxdə qoyub böyük bir ordu ilə hərəkət bayrağını Bədəxşana doğru qaldırdı. Sultan Mahmud mirzə ali məiyyətin gəlişindən xəbərdar olduqda, Hisari-Şadmandan çıxıb, Çəğaniyan[1423] dağına pənah apararaq Əmir Xosrovşahı çağırdı və qardaşları Əmir Vəli ilə Pir Vəlini o şəhərdə qoydu.

Bilikli padşah Ərhəng qəsəbəsində cah-calla dayandıqda, Əmir Cahangir Barlas və Sultan Üveys mirzə müzəffər bayraqlı ordu ilə suyu keçib, Vəxş vilayətinə basqın edərək istila bayrağını qaldırdılar və bir neçə gün sonra orduya qayıtdılar.

Bu əsnada Əmir Zünnun Zəmindavər[1424] tərəfdən bəla kimi təsirli bir ordu ilə Sultan Hüseyn mirzənin hüzuruna yönəlmişdi. O, Ərhəngə çatdıqda, Əmir Vəli və Pir Vəli igidlik meydanının atlılarından [ibarət] bir dəstə ilə Qunduzdan çıxıb Əmir Zünnunun yolunun üstünü tutdular. Çoxlu çalış-vuruşdan sonra onlar Əmir Zünnunu əsir alıb öz yanlarına apardılar.

Bu xəbər Sultan Hüseyn mirzəyə çatdıqda onun qəzəb atəşi alovlandı. O, Qunduza yönəldi və döyüşkən igidlər dəstəsi ilə Zəngi çayı kənarında cah-calalla dayandı. İzdihamlı əsgərlər Qunduzu dairə kimi əhatəyə aldılar.

Sultan Mahmud mirzə Qunduzun mühasirə edildiyini eşitdikdə Məhəmməd Elçi Buğanı min nəfərlik yaxşı silahlanmış süvari ilə təcili bir şəkildə göndərdi ki, həmlə etsinlər. Məhəmməd Elçi Buğa qeyri-ənənəvi bir keçiddən Amudərya çayını keçib, gecə yarısı Sultan Hüseyn mirzənin ordusunun kənarına çataraq nağara çaldırdı. Onların sədası yüksək şanlı padşahın qulağına çatdı. Onun əmri ilə carçılar car çəkib əmirlərə və əs-

---

[1423] Çəğaniyan – Termezden şimal-şərqdə, Surxandərya vadisində yerləşirdi *(Ш.С.Камалиддинов. Историческая география Южного Согда и Тохаристана по арабоязычным источникам IX - начала XIII вв. Ташкент, 1996, гл. 2, параг. 4).*

[1424] Zəmindavər – Əfqanıstanın cənubunda, Şərqi Sistanda, dağlıq ərazidə yerləşən vadi və tarixi mahal. Qəndəhardan Hindistana gedən yol Zəmindavərdən keçirdi.

gərlərə çatdırdılar ki, "heç kim əsla öz çadırından çıxmasın və müxaliflərin fəryadına, fəğanına əhəmiyyət verməsin!". Həmçinin Əbülmöhsün mirzəni iki-üç min süvari ilə onları dəf etməyə göndərdi.

Məhəmməd Elçi Buğa düşmənlərin gəlişindən xəbər tutduqda qaçış vadisinə tələsdi. Əbülmöhsün mirzə döyüş günü atlılarından [ibarət] bir dəstə ilə çayın kənarında müxaliflərə yetişdi. Döyüş və vuruş atəşi alovlandı. Məhəmməd Elçi Buğa istədi ki, gəmiyə otursun və özünü bəla burulğanından nicat sahilinə çatdırsın. O, gəmiyə qədəm qoyduğu yerdə bir ox atılıb onun həyat qayığını ölüm dənizinə qərq etdi. Onun yoldaşlarından da təqribən səksən nəfər öldürüldü. Əbülmöhsün mirzə belə bir qələbədən sonra zəfərə yaxın olan orduya qayıtdı.

Bu xəbər Sultan Mahmud mirzəyə çatdıqda, onun könlünü tamamilə qorxu bürüdüyündən, sülh və asayiş istədi. O, Əmir Bozorg Tirmizini anlaşmaq və sülh bağlamaq üçün hökmdarın dərgahına göndərdi. Adı çəkilən şəxs ali taxtın ətəyinə tələsib elçilik şərtlərini yerinə yetirdi. Əhd-peyman bağlandıqdan sonra [Sultan Mahmud mirzə] əsir alınmış Əmir Zünnuna mehribanlıq göstərib onu bol peşkəşlə Əmir Məhəmməd Bağırla birlikdə Sultan Hüseyn mirzənin hüzuruna göndərdi. Ona görə də o həzrət Qunduz ətrafından köç edib Bəlxə yola düşdü.

**Müxtəlif hadisələr**

Bu il Sultan Hüseyn mirzə tərəfindən Astarabad hakimi olan Bədiüzzaman mirzə İraq və Azərbaycanda çevrilişin baş verdiyi xəbərini eşitdikdə böyük bir ordu ilə Vəraminə gəldi. Bu xəbər Rüstəm padşaha çatdıqda onu dəf etmək üçün çoxlu qoşun göndərdi. Bədiüzzaman mirzə bunu eşitdikdə, onlara qarşı müqavimət göstərməyə tab gətirməyib Astarabada qayıtdı.

Həmçinin bu il Rüstəm padşah, Aybə sultanı qacar qoşunu ilə Gilan üzərinə göndərdi. Çünki Gilan camaatı Rey və Qəzvini talan etmişdi. Aybə sultan Qəzvin ətrafından keçib Larişəm dağında dayandı. Karkiya Mirzə Əlinin əmirülümərası olan Əmir Əbdülməlik Həsəni qaçdı. Qacar qoşunu Gilan padşahına məxsus olan bütün Rudbar ölkəsini qarət etdi. Gilan qoşunundan bir çoxlarını sözügedən ilin ramazan ayında (16.06-15.07.1493) qətlə yetirdilər və onların başlarından minarələr düzəltdilər.

**Ölümlər**

Mövlana Əbdürrəhman Cami bu il cümə günü, müqəddəs məhərrəm [ayının] 18-də (09.11.1492) Heratda kədərli dünyadan əbədi aləmə köçdü. O, Mövlana Səədəddin əl-Kaşğarinin yanında dəfn edildi. Ömrünün müddəti səksən bir il idi.

Əsərləri bunlardır: Mirzə Əbülqasım Baburun adına yazdığı "Risaleyi-müəmma" ("Müəmma risaləsi")[1425]; üç ədəd qəzəllər divanı; "Təfsiri-ayat" ("Ayələrin təfsiri"); "Şəvahidün-nübüvvət" ("Peyğəmbərliyin şahidləri"); "Nəfəhatül-üns" ("Ülfət ətirləri"); "Nəqdi-nüsus" ("Mənaların nağdı"); "Risalə dər təriqi-sufiyan" ("Sufilərin yolu haqqında risalə"); "Şərhi-füsusul-hikəm" ("Hikmət qaşlarının şərhi"); Ləvameyi-fərziyyə" ("Fərziyyə parıltıları"); "Şərhi-rübaiyyat" ("Rübailərin şərhi"); "Ləvayih" ("Layihələr"); "Şərhi-beyti-Əmir Xosrov Dehləvi" ("Əmir Xosrov Dehləvinin beytinin şərhi"); "Şərhi-hədis" ("Hədis şərhi"); "Süxənani-Xoca Parsa" ("Xoca Parsanın sözləri"); "Tərcümeyi-ərbəin hədis" ("Qırx hədis tərcüməsi"); "Mənaqibi-mövləvi" ("Mövləvi mənqibələri"); "Mənaqibi-Xoca Abdullah Ənsari" ("Xoca Abdulla Ənsarinin mənqibələri"); "Risalə dər təhqiq" ("Təhqiq haqqında risalə"); "Gülüstan"ın[1426] cavabında və müqabilində yazdığı "Baharistan"; "Şərh bər Kafiyyə" ("Kafiyyəyə dair şərh"); "Silsilətüz-zəhəb" ("Qızıl silsilə"); "Töhfətül-əbrar" ("Nəciblərin töhfəsi")[1427]; "Yusif və Züleyxa"; "Fərhad və Şirin"; "Leyli və Məcnun"; "Xirədnameyi-İsgəndəri" ("İsgəndərin müdriklik kitabı")[1428].

---

[1425] Müəmma – klassik Şərq poeziyasında mənzum tapmaca. Müəmmalarda əsas fikir müxtəlif üsullarla gizli ifadə edilir. Müəmma yaratmaq şairlərdən dərin bilik tələb edirdi.

[1426] "Gülüstan" – İran şairi Sədi Şirazinin əsəridir.

[1427] Güman ki, burada Caminin "Töhfətül-əhrar" ("Azad insanların töhfəsi") və "Sübhətül-əbrar" ("Nəciblərin duası") adlı iki müxtəlif əsərinin adları bir-birinə qarışdırılmışdır. Eyni zamanda, yuxarıda "Nəqdi-nüsus" və "Şərhi-füsusul-hikəm" ayrı-ayrı əsərlər kimi təqdim edilsələr də, əslində burada eyni əsərdən söhbət gedir və həmin əsərin tam adı belədir: "Nəqdün-nüsus fi şərhül-füsus" *(Nəvai, şərhlər, s.896).*

[1428] Müxtəlif mənbələrdə Caminin əsərlərinin sayı 45, 47 və 54 olaraq göstərilmişdir *(Nəvai, şərhlər, s.894).*

## 899-CU İLİN (12.10.1493 – 01.10.1494) HADİSƏLƏRİ

Bu il Sultan Əhməd mirzə və Sultan Mahmud xan böyük bir qoşunla Əndicana getdilər. Sultan Mahmud xan Xocənd çayının şimal tərəfindən və Sultan Əhməd mirzə çayın cənub tərəfindən Əndicana doğru irəlilədilər. O əsnada həmin diyarın hakimi olan Ömərşeyx mirzə göyərçin hininin damından yıxıldı və onun ruhunun göyərçini bədən qəfəsindən uçdu.

Sultan Əhməd mirzə bu xəbəri eşitdikdə, Mürğinan[1429] və Xocəndi ələ keçirib, Əndicanın dörd fərsəxliyində dayanaraq mühasirə məqamında sabitqədəm oldu. O əsnada Ömərşeyx mirzənin ölümündən sonra Əndican valisi olmuş Babur padşah müxaliflik etmiş Dərviş Kavı qətlə yetirdi. Bu cəza əndicanlıların qorxmasına səbəb oldu və onlar şəhəri mühafizə etdilər. O zaman Məhəmməd Babur padşah, Xoca Mövlana Qazını və Uzun Həsən Xocanı[1430] Sultan Əhməd mirzənin yanına yolladı və ərz etdi ki, "o həzrətin Səmərqəndi qoyub Əndicanda qışlaq etməyəcəyi yetərincə aydın olduğu üçün bu vilayətin hakimiyyətini bu cənaba (Babura) verməsi məsləhətdir". Sultan Əhməd mirzə onun cavabında xoşagəlməz sözlər dilə gətirib şəhərin yaxınlığında çadırlar qurdu. Amma həmin vaxt at vəbası baş qaldırdı. Sultan Əhməd mirzənin əsgərlərinin atlarının əksəri yoxluq otlağına üz tutdular (öldülər). Ona görə də onların arasında sülh bağlandı. Sultan Əhməd mirzə Səmərqənd tərəfə yola düşdü. Sultan Mahmud xan Əndicana gəlmək istəsə də, xəstələndiyi üçün öz diyarına yollandı.

### Ölümlər

Bu il Mirzə Ömərşeyx ibn Sultan Əbu-Səid ibn Mirzə Məhəmməd ibn Mirzə Miranşah ibn Sahibqiran Əmir Teymur Kürəkan düşənbə günü, ramazan ayının 4-də (08.06.1494)[1431] göyərçin hininin damından yıxılıb fani aləmdən əbədi məkana köçdü. Ömrünün müddəti otuz üç il idi. Ondan üç oğul yadigar qaldı: birincisi Babur padşahdır ki, anası Yunis xanın qızı Qutluq Nigar xanımdır; ikincisi Cahangir mirzədir. Vilayəti Fərqanə idi[1432]. Onun ölümündən sonra Babur padşah səltənət taxtına əyləşdi.

Sultan Əbu-Səidin oğlu Sultan Əhməd mirzə bu il Əndican səfərindən qayıtdıqdan və Abi-şor (Şor su) kənarına çatdıqdan sonra kədərli dünyadan əbədi aləmə köçdü. Ömrünün müddəti qırx dörd il olub, məmləkəti Səmərqənd və Buxara idi. Qardaşı Sultan Mahmud mirzə Bədəxşandan böyük ordu ilə sürətli yürüş edib Səmərqəndi ələ keçirdi.

* * * * *

Bu əsərin müəllifi, Əmir sultan Rumlunun nəvəsi Həsən Rum, Cağatay və Qaraman sülaləsi padşahlarının dəyərli xəbərlərini və maraqlı əməllərini 800-cü ildən[1433] 900-cü ilə kimi yazdı və inşallah, bəyan yüyənini Həzrət Şah İsmayılın və Şah Təhmasibin hakimiyyəti dövrünün heyrətamiz hadisələrinin, onların fəthlərinin keyfiyyətinin və onların müasiri olan sultanların, alimlərin və şairlərin təsvirinə doğru çevirir.

[1429] Mürğinan – Fərqanə vadisində tarixi şəhər.
[1430] Nuruosmaniyyə nüsxəsi: "Dərun Həsən".
[1431] Miladi ilə verdiyimiz tarix yekşənbə (bazar) gününə təsadüf edir.
[1432] Baburun digər bir qardaşı da Nasir mirzə idi *(Nəvai, şərhlər, s.1029).*
[1433] Əslində bu cildin məlum olan hər iki nüsxəsi h. 807-ci ildən başlayır *(Nəvai, şərhlər, s.898).*

## MÜQƏDDİMƏ

Mərhəmətli və rəhmli Allahın adı ilə!

Hədsiz və misilsiz tərif, dua və şükür elə bir sultana layiqdir ki, onun izzət və calal əlamətləri törəyiş və imkan səmtindən arınmışdır və zatının həqiqi mahiyyətinin möhtərəm hərəmi insanın bəsirət gözündən və xəyalından uzaqdır. Minlərlə alqış [olsun] peyğəmbərlik divanının əmirinə və əzəmət eyvanının taxtında oturana!

Nəzm

"Bayrağının xətləri "inna fətəhna"[1434],
Qoşununun yardımçısı "inna kəfəyna"[1435].

Minlərlə salam [olsun] rəsulun (Məhəmməd peyğəmbərin) ardıcılına və onun ismətli zövcəsinə[1436], ululuq səmasının günəşinə, "la-fəta"[1437] dəryasının dürrünə!

"Qəti dəlil, haqq imamı, möminlərin əmiri,
Mərdlik dənizi, bilik mədəni, Aləmlərin Rəbbinin lütfü".

Amma daha sonra bu pərişan kəlmələri yazan və bu nizamsız məqalələri qələmə alan, özünü tarixçilərin ayaqlarının altındakı torpaq sayan Əmir sultan Rumlunun nəvəsi Həsən bu cildi də cavanbəxt və səltənət şüarlı şahzadə, ali mənşəli xaqanların ən ümdəsi, şahlıq taxtının varisi, padşahlıq kürsüsündə əyləşən, Rəbbin hüsn-rəğbəti ilə əhatə olunmuş, İlahinin yaratdığı əsərlərin məzhəri, səltənət və səadət səmasının günəşi, şövkət və fatehlik günbəzinin bədirlənmiş ayı, əzəmət və cah-calal bayraqlarını yüksəldən, zülm və zəlalət binalarını məhv edən, mömin övliyaların yardımçısı, baş qaldıran düşmənləri qəhr edən, mətanət meydanının qızğın aslanı, şücaət Ceyhununun timsahı İsmayıl mirzənin[1438] adına yazmışdır. Bu cild cənnətməkan həzrət, Allahın kölgəsi, Ulu Məlikin (Allahın) rəhmətinə qovuşan, əbədiyyət sahibi ("əbül-bəqa") Şah İsmayılın cahanı idarə etmək və ölkələri tutmaq xəbərlərindən və nişanələrindən ibarətdir və eləcə də xilafət və cahandarlıq mücrüsünün incisi, şövkət və səadət bürcünün günəşi, sultan oğlu sultan, zəfər sahibi ("əbül-müzəffər") Şah Təmasib Bahadır xanın – Allah onun mülkünü və səltənətini əbədi etsin və aləmləri onun ədaləti və yaxşılığı ilə doldursun – səltənəti zamanının hadisələrini, Rumiyyə sultanlarının, Cağatay və Özbək xanlarının, onların müasirləri olmuş məşhur üləmanın, sədrlərin[1439] və vəzirlərin əhvalını əhatə etməkdədir. Bundan sonra hər nə yazılacaqsa, "İsgəndər şanlı xaqan" ("Xaqani-İsgəndər-şən")[1440] [ifadəsinin] açması Şah İsmayıldır, "dinin pənahı olan şah" ("şahi-din-pənah") [ifadəsinin] məqsədi Şah Təhmasibdir və "aləm sakinlərinin şahzadəsi" ("şahzadeyi-aləmiyan") [ifadəsinin] muradı İsmayıl mirzədir.

## 900-CÜ İLİN (02.10.1494 – 20.09.1495) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### Sultan Əli padşahın Rüstəm bəy Türkmanın fərmanı ilə şəhid edilməsi və zamanın bəzi hadisələri və dəyişiklikləri haqqında

Bu il Rüstəm bəy ali nəsəbli şahzadələri[1441] darülirşad Ərdəbilə göndərdi ki, əvvəlki kimi orada sakin olub xalqı zəlalətdən hidayətə irşad etsinlər (yanlış yoldan doğru yola yönəltsinlər). Rüstəm bəyin rüxsəti ilə onlar Ərdəbili hidayət təsirli nurlarının şəfəqi ilə bəzəyərək uca cənnətin oraya həsəd aparmasına səbəb oldular. Elə ki fələk rütbəli şahzadələrin başına təriqət əhlinin izdihamla toplanması xəbəri Rüstəm padşaha çatdı,

---

[1434] "İnna fətəhna" – "Quran"ın "Fəth" surəsinin ilk ayəsinə işarədir. Həmin ayənin mənası: "Həqiqətən, Biz sənə açıq-aşkar bir zəfər bəxş etdik".

[1435] "İnna kəfəyna" – "Quran"ın "Hicr" surəsinin 95-ci ayəsindən bir ifadədir. Mənası: "Biz sənə kifayət edərik".

[1436] Peyğəmbərin ardıcılı dedikdə Həzrət Əli nəzərdə tutulur. Onun zövcəsi isə Məhəmməd peyğəmbərin qızı Fatimə xanımdır.

[1437] Məhəmməd peyğəmbər Həzrət Əli haqqında buyurmuşdur: "La fəta illa Əli, la seyfə illa Zülfiqar" ("Əlidən başqa igid, Zülfüqardan başqa qılınc yoxdur"). Burada həmin kəlama işarə edilir və Həzrət Əli ilə onun zövcəsi Həzrət Fatimə mədh olunur.

[1438] İsmayıl mirzə – II Şah İsmayıl adı ilə 1576-1577-ci illərdə hökmranlıq etmişdir.

[1439] Sədr – funksiyası dövlətin dini siyasətinin həyata keçirilməsinə başçılıq etməkdən ibarət olan yüksək saray vəzifəsi (bax: *О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.259-262; Ş.F.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.47-49*).

[1440] Həsən bəy Rumlu, I Şah İsmayılın şan-şöhrətini və əzəmətini qədim dövrün böyük fatehi Makedoniyalı İsgəndərə tay tutmaq üçün onu belə bir təmtəraqlı titulla yad etmişdir. Müəllifin Şah İsmayılı türklərə xas olan "xaqan" istilahı ilə xatırlaması diqqətəlayiq faktdır.

[1441] Şeyx Heydərin oğulları nəzərdə tutulur.

o, qorxub vahiməyə düşərək, öz hakimiyyətinin zavala uğrayacağından ehtiyat edib şahzadələri gətirmək üçün adam göndərdi, İsgəndər şanlı xaqanı qardaşları ilə birlikdə öz ordusuna gətirdi və əmr etdi ki, sufilərdən heç kəs onların xidmətində olmasın. Həmin qış mövsümündə [Rüstəm padşah] Xoyda qışlaq edib, yazda yaylağa getdi. O, qəsd etdi ki, Sultan Əli padşaha şəhidlik şərbəti içirsin. Xidmətkar[1442] nökərlərdən biri bi fikrin mahiyyətini [Sultan Əliyə] ərz etdi. O üfüqlər sərvəri nifaq sahiblərinin hiyləsindən xəbərdar olduqda öz qardaşları ilə birlikdə Ərdəbilə tələsdi. O hüdudda olan sufilər və qazilər xidmət kəmərini canlarının ortasına bağladılar və o həzrətin məiyyətinə qoşuldular.

Sultan Əli padşahın[1443] qaçmasından və kinli qazilərin toplanmasından xəbər tutan Rüstəm bəy cəhalət və nadanlıq üzündən Hüseyn bəy Əlixanlı adlı dayısı oğlunu Aybə sultanla[1444] ittifaqda güclü bir qoşunla[1445] Sultan Əli padşaha qəsd etmək üçün Ərdəbilə göndərdi. Mərhum şahzadə Sultan Əli padşah övliyalıq nuru ilə bildi ki, düşmənlərin əlindən şəhidlik şərbətini içəcəkdir. [Buna görə də] tacını başından götürüb, İsgəndər şanlı xaqanın başına qoyaraq onu Ərdəbilə göndərdi. Bu əsnada düşmən əsgərləri göründülər. Aybə sultan bir dəstəni pusquda qoyub, özü döyüş və vuruş meydanına yönəldi. Sultan Əli padşah düşmənlərin qarşısında səf qurdu. Gözü onların bayrağına sataşdıqda, qəzəbli aslan kimi heç nədən qorxub çəkinməyərək onlara həmlə etdi, çoxsaylı səfləri bir-birinə vurdu və elə döyüşdü ki, Rüstəm və İsfəndiyar dastanını kölgədə qoydu. O həzrət gah misri qılıncla boyunların üzərindəki başları bədəndən ayırır, gah da nizə ilə ayrı-ayrı dilavərləri bir-birinə bitişdirir, sivri ox tikanı ilə vücud köynəyində səbanın gül qönçəsini açdığı kimi yaralar açır, qan tökən nizənin ucu ilə ömür qəbasını sərsər küləyi kimi zay edərək onu deşib lalə rənginə döndərir, ömür budağından həyat çiçəyini külək kimi yoxluq torpağı üzərinə tökür, iti poladla daşa və zindana bənzər ürəklərdə atəş yandırır və od saçan yaranın küləyi ilə düşmənin qanını su kimi torpağın səthinə axıdırdı. Aybə sultan və Hüseyn bəy Əlixanlı ona tab gətirməyib idbar üzlərini fərar vadisinə çevirdilər. Qızılbaş qoşunu və dərbədər qazilər qənimət toplamaqla məşğul oldular. Aybə sultanın qoşunlarının pusquda duran dəstəsi xilaf qılıncını qılafdan çıxarıb, qarətlə məşğul olan adamları iti qılınca yem etdilər. Həmin an Sultan Əli padşahla birlikdə olan təxminən üç yüz nəfərlik dəstə düşmənlərə həmlə etdi. Onun at çapdığı yolun üzərində bir nəhr vardı. O həzrət oraya düşdü və onun boynu qırıldı. Düşmənlər onun mübarək başını bədənindən ayırdılar və Rüstəm bəyə göndərdilər.

**İsgəndər şanlı xaqanın əhvalının və onların Lahicana tərəf getməsinin cüzi bir qismi haqqında söhbət**

İsgəndər şanlı xaqan cənnət məkanlı və behişt məskənli qardaşı tərəfindən ulu irşad və hidayət mərtəbəsinə yüksəldildikdən və “Biz uşaq ikən ona hikmət verdik”[1446] tacı ilə zinətləndirildikdən sonra behişt məskənli qardaşı tərəfindən digər qardaşları ilə birlikdə Aybə sultanla hərbdən və döyüşdən əvvəl Bəğrov yaylağından darülirşad Ərdəbilə göndərildilər ki, müqəddəs məqbərədə sakin olsunlar. Sultan Əli padşahın başına gələn dəhşətli hadisədən sonra anası Aləmşah bəyim[1447] onun mübarək cəsədini müqəddəs astanaya gətirdi. Aləmşah bəyim ürəkdən sevdiyi oğlunun yasını və matəmini saxlamaqla məşğul olub, səbir yaxasını kədər və qorxu əli ilə parçalayaraq dözümsüzlük külünü sükunət və qərar başına tökürdü. Bu müsibətlə yanaşı, onun ürəyi narahat idi ki, məbada [İsmayıl] zalımların əlində giriftar olar və onun həyat çırağı düşmənlərin cövrünün sərt küləyindən sönüb məhv olar. Aybə sultanın fəlakət əlamətli qoşunu təcavüz və zülm əlini uzadıb, məmləkətin dolanışığı üçün lazım olan hər şeyi ələ keçirməkdən və talamaqdan, qarət və qətl törətməkdən zərrəcə çəkinməmişdi.

Amma düşmənlərin gümanı o idi ki, kəramətli xanədanın sufiləri və müridləri alinəsəb şahzadəni Ərdəbildən çıxarmışlar. Halbuki o, Ərdəbildə gizlin və məxfi saxlanmışdı. Amma axırda öyrəndilər ki, alinəsəb şahzadə Ərdəbildədir. Çox araşdırmadan sonra öyrəndilər ki, bir arvad onu gizlətmişdir. Amma o arvadın kimliyi haqqında məlumat olmadığından ona yol tapa bilmədilər. “Vilayət”in pənahı olan Sultan Şah Cüney-

---

1442 Baroda nəşri: “peşəsi həqiqət olan” və ya “həqiqət peşəli”.
1443 Məclis nüsxəsi: “Şahzadələrin”.
1444 Bakı nüsxəsi: “Əbih sultan”.
1445 Nuruosmaniyyə və Bakı nüsxələri: “Azğın bir qoşunla”.
1446 *Qurani-Kərim, “Məryəm” surəsi, 12-ci ayə.*
1447 Mətndə “Ələmşah bəyim” yazılmışdır.

din ləyaqətli qızlarından olan və mürşidi-kamil (Şeyx Heydər) tərəfindən Məhəmməd bəylə evləndirilən ismət mücrüsü, iffət və paklıq sədəfinin gövhəri Şah Paşa xatun ali səviyyəli şahzadənin halından xəbərdar idi və bütün səyini o "vilayət" mədəninin incisinin əldə edilməsinə və o hidayət xəzinəsinin gövhərinin qorunmasına sərf edirdi. O həzrət üç gün Qazı Əhməd Kakulinin evində qaldı.

Adı çəkilən qazının evi nurlu və ətirli astananın (Şeyx Səfi məqbərəsinin) yaxınlığında idi. Ora düşmənlərin gəliş-gediş və camaatın keçiş yolu üzərində yerləşdiyindən, narahat bir yer idi. Bir şəxs "O uşağa baxacaq, həm də ona yaxşı davranacaq bir ailəni sizə nişan verimmi?"[1448] [ayəsinə] vasitə olub, onu (İsmayılı) Xancan adlı bir arvadın mənzilinə apardı. [İsmayıl] təxminən bir ay onun mənzilində oldu və həyat (dirilik) çeşməsi kimi düşmənlərin nəzərindən gizli qaldı. Ondan sonra Şah Paşa xatunun məsləhəti ilə onu zülqədər qəbiləsindən olan Aba adlı qadına tapşırdılar. Bu qadın alinəsəb şahzadənin südəmərlik əyyamında ona xidmət etmişdi. O, İsgəndər şanlı xaqanı sözügedən Xancanın evindən götürüb, Ərdəbil məhəllərindən olan Rumilər məhəlləsindəki öz mənzilinə apararaq bir neçə gün saxladı və oradan onu Ərdəbilin cümə məscidinin civarındakı Allahvermiş ağa məqbərəsinin günbəzinə aparıb on gün[1449] ona baxdı. O həzrətin anası Aləmşah bəyimin o "vilayət" sədəfinin incisinin uğurlu halından qətiyyən xəbəri yox idi. Günbəgün möhtərəm oğlunun hicranından onun sinəsinin ortasında qəm və qüssə atəşi alovlanırdı. Aba, Aləmşah bəyimin halının pərişanlığından xəbər tutduqda, "Qorxma və kədərlənmə! Biz onu sənə qaytaracağıq"[1450] müjdəsi ilə sevindirdi.

Amma Aybə sultanın adamları yoxlama və axtarışlarını günbəgün artırırdılar. Rüstəm padşah tərəfindən də dəfələrlə fərman verilmişdi ki, hansı yolla olursa olsun, mürşidi-kamilin (Şeyx Heydərin) həm oğul, həm də qız övladları ələ keçirilərək onların həyat xırmanı cəza qılıncının qığılcımı ilə yandırılsın. Axırda ali rütbəli şahzadənin anasına işgəncə verməyi düşündülər. [Lakin] "Heç bir ana uşağına görə zərər çəkməsin!"[1451] [ayəsinin] aydın mənası [onlara] mane oldu və o düşüncəni tərk etdilər. Aba da qorxub vahimələnərək, [İsmayılı] başqa bir yerə köçürməyə qərar verdi.

Aybə sultana qarşı hərbdə Şah Sultan Əlinin xidmətində olmuş, yara alaraq o mərəkədən fərar etmiş və Ərdəbilin cümə məscidində daldalanmış və gizlənmiş sufilərdən və qazilərdən bir şəxs öz yarasının müalicəsi üçün Abanın yanına gəlmişdi. Aba onu vəziyyətdən xəbərdar etdi, şahzadənin halının həqiqətini ona açıqladı və o, bu cəhətdən sevincli və şad olub, Abanın məsləhətinə uyğun olaraq, həmin hərbdən qaçıb Bəğrovda sakin olmuş Bayram bəyin əmisi Rüstəm bəy Qaramanlunun yanına getdi və onu şahzadənin halının həqiqətindən xəbərdar etdi. Rüstəm bəy gecə yarısı yerindən qalxdı və "Şəhərə əhalisi xəbərsizkən girdi"[1452]. Özünü Ərdəbildəki cümə məscidinin yaxınlığına çatdırdı və şahzadəni öz atının tərkinə alaraq Bəğrov tərəfə apardı. Bəziləri deyir ki, Aybə sultanla döyüşdən qaçmış səksən nəfər Bəğrovda toplanmışdı. O camaat da Rüstəm bəylə birlikdə gəlib şahzadəni Ərdəbildən Kürgan kəndinə gətirdilər. Üç gün Xətib Fərruxzad Kürganinin evində qaldı. Xətib Fərruxzad Kürgani onlara layiqincə xidmət göstərdi. Ondan sonra Mənsur bəy Qıpçaği, Lələ bəy, Qazaq Seydi Əli[1453], Çolpan bəy, Xüləfa bəy, Gög Əli[1454] və döyüşdən sağ-salamat çıxmış başqa sufilər alinəsəb şahzadə barəsində məşvərət etməyə başladılar və bu camaatdan hər biri bir məsləhət fikirləşib tapdı. Nəhayət, hamının rəyi bunda qərar tutdu ki, şahı Rəşt tərəfə aparsınlar və bir neçə gün orada qalsınlar. Çünki Şah Paşa xatunun əri Məhəmməd bəylə və onun qardaşı Əhmədi bəylə Rəşt valisi Əmirə İshaq arasında köhnə vaxtlardan möhkəm dostluq əlaqəsi qurulmuşdu və ardıcıl olaraq, bir-birilərinə töhfələr və hədiyyələr göndərdikləri üçün aralarındakı sədaqət və ülfət qapılarını açıq saxlayırdılar.

Bu niyyət ürəklərinə yatdı. Rüstəm bəy, Əhmədi bəy və Məhəmməd bəy etiqadlarında sadiq və ixlaslarında qəti olan səksən[1455] nəfər sufi ilə İsgəndər şanlı xaqanı götürüb Tul[1456] [adlı] yerə gətirdilər və "Qorx-

---

[1448] *Qurani-Kərim, "Qəsəs" surəsi, 12-ci ayə.*
[1449] Məclis nüsxəsi: "iki gün".
[1450] *Qurani-Kərim, "Qəsəs" surəsi, 7-ci ayə.*
[1451] *Qurani-Kərim, "Bəqərə" surəsi, 233-cü ayə.*
[1452] *Qurani-Kərim, "Qəsəs" surəsi, 15-ci ayə.*
[1453] Baroda nəşri: "Qırıq Seydi Əli"; Bakı nüsxəsi: "Qırıq Seyid Əli".
[1454] Bakı nüsxəsi: "Kök Əli".
[1455] Bakı nüsxəsi: "yetmiş".
[1456] Tul – Gilanın Kürganrud bölgəsinin kəndlərindəndir *(Nəvai, şərhlər, s.906).*

ma, artıq zalım tayfanın əlindən qurtarmısan”[1457] işarəsini yada salıb bir neçə gün Tul və Nav[1458] (Tulu-Nav)[1459] valisi Əmirə Müzəffərin evində qaldılar. Əmirə Müzəffər adət-ənənəyə uyğun qonaqpərvərlik və xidmətkarlıq yerinə yetirdi və xidmətdə bir dəqiqə belə səhlənkarlıq etmədi.

Aybə sultan Ərdəbildə xəbər tutdu ki, İsgəndər şanlı xaqan Əmirə Müzəffərin mənzilindədir. O, adı çəkilən Əmirənin yanına adam göndərib [bunları bildirdi]: “Sultan Heydərin oğlu sənə pənah gətirmiş və sığınmışdır. İtaət və tabeçiliyin qaydası budur ki, onu öz yoldaşları ilə birlikdə Rüstəm bəyin yanına göndərəsən”. [Aybə sultan, Əmirə Müzəffərə] növbənöv bəxşişlər və hədiyyələr vəd etdi və daha sonra onu qorxutdu və hədələdi ki, “əgər bu işdə laqeydlik və diqqətsizlik göstərsən, müxtəlif cəzalara məruz qalacağını bilmiş ol”. Xalxal hakimi Cagir bəy Pornak da adam göndərib eyni tələbi irəli sürdü və Əmirə Müzəffərə həm müjdə (vəd) verdi, həm də təhdid etdi. Əmir Müzəffər bu xanədana (Səfəvilərə) son dərəcə səmimiyyət və etiqadla bağlı olduğundan, arifcəsinə[1460] özünün bilməməzliyə vuraraq İsgəndər şanlı xaqanın Tulda olduğunu inkar etdi. [Qızılbaşlar] Cagir bəyin də müxaliflik və düşmənçilik mövqeyi tutduğunu gördüklərindən daha Tulda qalmağı münasib bilmədilər. Oradan çıxıb Kəsgərə[1461] yollandılar.

Əmirə Səyavuş Kəsgər hakimi idi. Kəsgər mahalındakı Dünyaçar[1462] [adlı] mövqedə Əmirə Səyavuşun Ənuş[1463] adlı mülazimi vardı[1464]. Əmirə Müzəffər onu çağırıb İsgəndər şanlı xaqanı yoldaşları ilə birlikdə ona qoşdu ki, [onları] Əmirə Səyavuşun yanına aparsın. Məhəmməd bəy və Əhmədi bəy Tuldan geri qayıtdılar. Onlar İsgəndər şanlı xaqana, sufilərinə və yoldaşlarına köməklik göstərməsi barədə Rəşt valisi Əmirə İshaqa məktub yazdılar. Onların çıxıb getməsi zəmanə xaqanının (İsmayılın) ürəyincə deyildi və bu üzdən çox qəm-qüssəyə qapıldı. Lakin onlar geri dönməyə məcbur idilər.

Amma şahın Kəsgərə doğru yolda olduğu [haqqında xəbər] Əmirə Səyavuşa çatdıqda, görüş qədəmi ilə [onu] qarşılamağa çıxıb təzim və ehtiram mərasimini yerinə yetirdi və xidmət göstərməkdə heç bir əskikliyə yol vermədi. Üç gün onun evində qaldılar. Daha sonra [Əmirə Səyavuş] yoldaşlıq kəmərini belinə bağlayaraq İsgəndər şanlı xaqanı[1465] Rəştə çatdırdı. Əmirə İshaqın bu ali sülaləyə olan bağlılığı, etiqadı, sevgisi və həmrəyliyi o qədər çox idi ki, şərh etməklə qurtaran deyil. Üç gün ərzində o, elə bir qonaqpərvərlik və ev sahibliyi nümayiş etdirdi ki, tale süfrəçisi (xansaları) dəyirmi ayı və günəşi yuxarı aləm sakinlərinin qidalanması üçün fələk tabaqlarına qoyduğu vaxtdan etibarən o cür bir ziyafət və o tərz və o sayaq bir məclis görülməmişdi.

Bəzi inanılmış adamlar deyirilər ki, həmin xeyirli səfərdə İsgəndər şanlı xaqanın qardaşları olan xilafət inciləri və “vilayət” ağacının meyvələri – Seyid Həsən mirzə, Seyid Süleyman mirzə, Seyid Davud mirzə və Seyid Mahmud mirzə [onunla] birlikdə idilər. Bəziləri isə deyirlər ki, onlar Rəştdə İsgəndər şanlı xaqana qoşulmuşlar. Bir sıra şəxslər isə deyirlər ki, İsgəndər şanlı xaqan qardaşları ilə birlikdə Çiçəklü kimi tanınan Ağdağ yolu ilə Məsuləyə getdilər və oradan Rəştə yönəldilər. Amma onu həmin yolda müşayiət etmiş bir kəs tapılmadı ki, onun sözünə etimad etmək olsun. Doğrusu odur ki, İsgəndər şanlı xaqan qardaşları ilə birlikdə Rəştə cah-calalla nazil oldu və Rəştdə yerləşən, Ağ məscid (“Məscidi-Sefid”) adlanan və indi də əvvəlki kimi abad olan bir məsciddə sakin oldu.

O məscidin quruluşu və vəziyyəti, havasının lətafəti, sahəsinin genişliyi və oranın səfası İsgəndər şanlı xaqanın ürəyinə yatdığı üçün digər bir yerə, xüsusən də Əmirənin mənzilinə köçmədi və onun bu barədə təkrar-təkrar etdiyi hədsiz-hüdudsuz dəvətlərə razı olmadı. O məscidin yaxınlığında Mir Nəcm adlı bir zərgərin dükanı vardı. Qonşuluq səbəbindən o, həmişə İsgəndər şanlı xaqanın xidmətində idi və töhfələr, hədiyyələr vasitəsi ilə onun şahanə hüsn-rəğbətini qazanmışdı. İsgəndər şanlı xaqanın Rəştdə qalması müddəti barədə ixtilaf mövcuddur. Bir sıra şəxslər deyirlər ki, yeddi gündən artıq qalmamışdır, bəziləri iyirmi gün deyirlər və bir qisim adamlar isə bir ay deyirlər.

---

[1457] *Qurani-Kərim, “Qəsəs” surəsi, 25-ci ayə.*
[1458] Nav – Əsalim dehistanında kənd *(Nəvai, şərhlər, s.906).*
[1459] Baroda nəşri: “Tul və Xalxal” (“Tulu-Xalxal”).
[1460] Baroda nəşri: “mükəmməl bir şəkildə”.
[1461] Kəsgər (Gəskər) – Astaradan Rəştə doğru gedən yolun üzərində, Gilanda yerləşən tarixi mahal.
[1462] Bu kənd hal-hazırda “Dünyaçal” adlanır *(Nəvai, şərhlər, s.906).*
[1463] Baroda nəşri: “Əmir Nuş”.
[1464] Bakı nüsxəsi: “... Ənuş adlı mülazimi hakim idi”.
[1465] Məclis nüsxəsi: “onları”.

İsgəndər şanlı xaqanın Rəştə gəldiyindən agah olan Lahican valisi Karkiya Mirzə Əli bildi ki, o, Ərdəbildən hər cür hadisələr ucbatından fərar etmişdir və Əmirə İshaq, İsgəndər şanlı xaqanla onun yoldaşlarını mühafizə etməyin öhdəsindən gələ bilməyəcəkdir. Buna görə də o, İsgəndər şanlı xaqanın Lahicana gəlməsini xahiş etdi. Elə ki xaqan Karkiya Mirzə Əli tərəfindən səmimiyyət və sədaqət mehini hiss etdi, məqsədinin Rəşt olmasına baxmayaraq, Lahicanda qalmağı qərara aldı və yubanmadan Lahicana yollandı. Karkiya bu hadisəyə son dərəcə sevindi və şadlandı. Onun hal dili gah bu məsəli tərənnüm edirdi:

Nəzm

“Mən gözümü dostu görmək[1466] üçün açmışam,
Necə şükür edim sənə, ey bəndələrə nəvaziş göstərən Qadir (Allah)?!”

Və gah bu beyti dilə gətirirdi:

Beyt

“Nə üçün yüksəlməsin astanamızın qədr-qiyməti,
Bir halda ki, günəş qədəm qoyur evimizə”.

O, bir dəqiqə belə səhlənkarlıq göstərmədən sədaqət və fədakarlıq şərtlərini yerinə yetirdi və Lahican meydanında, Kiya Fəridun mədrəsəsi qarşısında İsgəndər şanlı xaqan üçün bir mənzil ayırdı. Xaqan cah-calalla o mənzilə daxil olub, dua və şükür etmək üçün dilə gələrək o mənzildə yaşamağa başladı.

Hələ də Ərdəbildə qalmaqda olan Aybə sultan, İsgəndər şanlı xaqanın Rəştdən Lahicana getməsi haqqında xəbər aldı. Ondan sonra Rüstəm bəyin hüzuruna yollandı. Aba adlı [qadını] ələ keçirib darüssəltənə Təbrizə apardı və Rüstəm bəyin əmri ilə Təbriz meydanında sözügedən Aba dara çəkildi (asıldı). Aybə sultan Rüstəm bəyin hüzuruna getdikdən sonra Məhəmməd bəylə Əhmədi bəyin İsgəndər şanlı xaqana göstərdikləri hüsn-rəğbət barədə öyrənib bildiklərini [Rüstəm bəyə] ərz etdi. Rüstəm bəyin qeyrət və şərəf atəşi alovlandı. O, hökm etdi ki, onların bütün mal-dövlətlərini müsadirə etsinlər. Axırda Rüstəm bəyin dədəsi[1467] Qara Dədə onların bağışlanması üçün dil tökdü, onların otuz min təngə[1468] məbləğində cərimə edilməsini qərarlaşdırdı və Rüstəm bəydən onların günahından keçməsini xahiş etdi.

## İsgəndər şanlı xaqanın Lahicanda qalması

İsgəndər şanlı xaqan öz səadətli addımlarının gəlişi ilə Lahicanı ulu cənnətin həsəd apardığı bir yerə çevirdikdən və o rahat diyarda yaşamağa və qalmağa başladıqdan sonra Karkiya Mirzə Əlinin ixlasının, bağlılığının və sədaqətinin amilləri günbəgün daha artıq dərəcəyə və daha yüksək mərtəbəyə çatırdı. O, hər cür xidmət və hörmət göstərməklə ali mənşəli padşahın kimya [kimi] təsirli nəzərini özünə cəlb edirdi. Bu müddət ərzində sadiq sufilər yaxından və uzaqdan, xüsusən də Rum diyarından, Qaracadağdan[1469], Meşkin tüməninden və s. yerlərdən nəzirlərlə, hədiyyələrlə və töhfələrlə Lahicana, İsgəndər şanlı xaqanın hüzuruna gəlirdilər və öz hədiyyələrini onun düzgün nəzərlərinə təqdim etdikdən sonra qalmağın münasib olmadığını düşünərək, təcili şəkildə çıxıb gedirdilər.

Uca məqamlı padşah, Mövlana Şəmsəddin Lahicaninin yanında “Qurani-Məcid” oxuyurdu. Rəştdə şahın yanında olan Əmir Nəcm Zərgər, Karkiya mirzə Əlinin qardaşları Sultan Həsən və Əmir Haşımla birlikdə tez-tez o həzrətin hüzuruna gəlirdilər. Şah onlarla həmsöhbət və həmməclis olmağa tamamilə alışmışdı[1470] və bu, o həzrətin sevincinə və ürəyinin açılmasına səbəb olurdu. Elə bir məqam gəlib çatdı ki, [İsmayılın] mübarək səhhəti pozuldu və o, qəflətən xəstələndi. Mövlana Nemətulla o xəstəliyə əlac tapmaq üçün çox çalışdı. Buna baxmayaraq, həmin xəstəlik bir ilə qədər davam etdi. Daha sonra “Xəstələndiyim zaman mənə yalnız O şəfa verir”[1471] darüşşəfasının həkimi (Allah) şəfa kərəm etdi, xəstəlik bütünlüklə yox oldu, ali səhhət düzəlməyə doğru üz qoydu və ruzigarın dili bu beytlərin məzmunu ilə [bu hadisəni] tərənnüm etməyə başladı:

Beyt

[1466] Məclis və Bakı nüsxələri: “şahı görmək”.
[1467] Dədə – Türk dünyasında bəzi təriqət böyüklərinə və mənəvi öndərlərə verilən ünvandır.
[1468] Təngə – kiçik pul vahidi olan sikkə. 200 təngə = 1 tümən *(Seddon, şərhlər, s.216).*
[1469] Qaradağ (Qaracadağ) – Cənubi Azərbaycanda, Araz çayının cənubunda, Təbrizdən şimal-şərqdə tarixi vilayət.
[1470] Baroda nəşri: “Şah onların mühafizəsindən və həmməclis olmaqlarından tamamilə şənlənmişdi”.
[1471] *Qurani-Kərim, “Şüəra” surəsi, 80-ci ayə.*

“Tanrıya şükür olsun ki, dünyanın pənahı olan hökmdarın zatı,
Sağlamlığa qovuşmuşdur, Allahın lütfünün feyzi ilə.
Bostan barını dostların üzərinə tökdü bu sevincdən,
Parlaq ay göy üzündə papağını saldı [yerə] bu şadlıqdan”.

Ondan sonra ali məqamlı şah buyurdu ki, o həzrətin bibisi olan Şah Paşa xatun darülirşad Ərdəbildə bəzi nemətlər, xüsusən də şahın meylinin çox çəkdiyi və sözlə ifadə edilməsi mümkün olmayan dərəcədə rəğbət bəslədiyi narın (xırda) çörək (“nani-rize”) hazırlatdırıb Lahicana göndərsin. Şah Paşa xatun itaəti vacib olan əmrə uyğun olaraq, hədiyyə və töhfələri tərtib edib bir sıra qohumları və yaxınları ilə Gilana göndərdi. Onun göndərdikləri Rəştə yetişəndə və onların gəlişi xəbəri alinəsəb şahın qulağına çatanda onları qarşılamaq və ulu dərgaha gətirmək üçün Gög Əlini göndərdi. Mir Nəcm Zərgər və Əmirə İshaqın vəkilləri olan Mir Musanın oğlu Mir Həsənlə[1472] Əmir Cahangir Rəşti onlara yoldaş olub Lahicana yollandılar. Ali məqamlı şah, Karkiyaya və onun qardaşlarına o hədiyyələrdən göndərdi və Əxi Mehmandara[1473] əmr etdi ki, o camaata (qonaqlara) hörmət və diqqət göstərsin, qonaqpərvərliyin və ev sahibliyinin şərtləri nədirsə, yerinə yetirsin. O camaat üç gün ərzində Lahicanda qaldı. Ondan sonra ayrılmaq izni alıb geri döndülər. Lahican sultanları və sözügedən xanımın (Şah Paşa xatunun) hədiyyələrindən faydalananlar bunun müqabilində onun üçün nəfis qumaşlardan, əmtəələrdən, kök toyuqlardan, balıqlardan, narıncdan, limondan və s. Gilan sovqatlarından [ibarət] növbənöv töhfələr və hədiyyələr göndərdilər. O camaat Ərdəbil kəndlərindən olan Kurim[1474] kəndinə çatdıqda, onların gəlişindən xəbər tutan Şah Paşa xatunla Məhəmməd bəy adı çəkilən kəndə yollanıb, həmin töhfələri və hədiyyələri götürərək darüssəltənə Təbrizə, Rüstəm bəyin hüzuruna yollandılar. Onlar Rüstəm bəyin dövlətinin valiləri tərəfindən müsadirə olunmuş Əhmədi bəyin mallarını və əmlakını bu yolla geri almağı ümid edirdilər.

Onlar yenə də Qara Dədəyə pənah aparıb onun vasitəsilə öz hədiyyələrini Rüstəm bəyin nəzərinə çatdırdılar. [Rüstəm bəy hədiyyələrdən] razı qaldı və [onları] qəbul etdi, əmlakı və malları onların ixtiyarına verdi. Onlar xələtlərlə şərəfləndirildilər və Rüstəm bəyin divanından bir hökm verildi ki, bundan belə heç kəs onların əhvalına toxunmasın.

### Müxtəlif əhvalatlar

Bu il Mənsur bəy Pornak Fars əyalətinin [hakimliyindən] çıxarıldı və oranın sahibliyi Nurəli bəyə verildi. Bir müddət bu minvalla davam etdikdən sonra səltənətin sütunu (“rüknüssəltənə”) olan Seydi Əli bəy Pornak ərz etdi ki, Şiraz Mənsur bəyin gorxanasıdır (məskənidir, yurdudur). Ona görə də Fars məmləkətini yenidən ona həvalə etdilər. Mənsur bəy Farsa yollandı. [Amma] elə bir xəstəliyə düçar oldu ki, işlərin öhdəsindən gələ bilmədi və [onun] vəkili Şahqulu bəy işləri həll edirdi. Divan əmiri Qasım bəy son dərəcə paxıllıq üzündən Şahqulu bəyi qətlə yetirdi və onunla kifayətlənməyib, Mənsur bəyi də kənarlaşdıraraq işlərə təkbaşına əncam çəkməyə başladı. Onun vəkilləri, xüsusən də Xoca Ruhulla Qəzvini zülmkarlıq əllərini uzatdılar. Buna görə də Şirazın vəziyyəti [mənfi yöndə] dəyişdi.

### Ölümlər

Sultan Mahmud mirzə ibn Sultan Əbu-Səid həmin ilin rəbiüləvvəl (1494-cü ilin dekabr) ayında axirət aləminə köçdü. Zalım və günahkar bir padşah idi. Ömrünün müddəti qırx üç ildir. Məmləkəti Səmərqənd, Buxara və Bədəxşan idi. Beş oğlu vardı: Sultan Məsud mirzə, Sultan Əli mirzə, Sultan Hüseyn mirzə, Baysunqur mirzə, Sultan Üveys mirzə.

Bu il Rəziəddin Mürtəza ibn Seyid Şərif öldü. Yetmiş yaşı vardı.

[1472] Məclis nüsxəsi: “Mir Hüseynlə”.
[1473] Bakı nüsxəsi: “Rəzi Mehmandar”.
[1474] Çox güman ki, bu, hal-hazırda Ərdəbil vilayətinin Yurtçu dehistanına daxil olan Kuraim kəndidir *(Nəvai, şərhlər, s.911).*

## 901-Cİ İLİN (21.09.1495 – 08.09.1496) HADİSƏLƏRİ

### Sultan Hüseyn mirzənin Hisari-Şadmana getməsi haqqında söhbət

Bu il Sultan Hüseyn mirzə Bədəxşan, Qunduz və Bəğlan məmləkətini ələ keçirmək əzmi ilə hərəkət bayrağını qaldırdı. Yayın əvvəllərində o, adı çəkilən vilayətə doğru yola çıxdı. Ceyhundan keçib Biya kəndində dayandı. Oranın padşahı Sultan Məsud mirzə zəfər bayraqlı mirzənin hərəkətindən xəbər tutan kimi Hisar qalasını Əmir Bağıra, Əmir Mahmud Barlasa və Dərvişəli Sarbana tapşırdı, özü isə məhdud bir dəstə ilə Şəhri-Səbzə tərəf qaçdı. Sultan Hüseyn mirzə Hisar qalasını bir mərkəz kimi dövrəyə aldı. Bir neçə gün Hisar əhli ilə müzəffər qoşun arasında döyüş və vuruş baş verdi. Axırda Hisar əhlinin işi çətinə düşdü. Onlar aman istəmək üçün dünyanı tutan hökmdarın dərgahına şirin dilli elçilər göndərdilər, günahlarının bağışlanmasını istədilər və qəbul etdilər (söz verdilər) ki, o ali xasiyyətlinin (Sultan Hüseyn mirzənin) Herat tərəfə qayıtmasından sonra Sultan Mahmud mirzənin qızını layiqli ləvazimatlar və müvafiq töhfələrlə fələk məkanlı astanaya yollayacaqlar.

Hisar işi həllini tapdıqdan sonra hərəkət yüyənini Qunduz səmtinə yönəltdi. Oranın hakimi Əmir Xosrovşah, Nəzər Bahadırı layiqli peşkəşlərlə [onu] qarşılamağa göndərdi və mirzə bununla kifayətlənib, Herat taxtgahına qayıdaraq Bəlx hakimliyini (hökumətini) öz həqiqi xələfi və əziz oğlu Bədiüzzaman mirzəyə həvalə etdi.

### Müxtəlif əhvalatlar

Bu il Novruz bayramından ("Novruzi-sultani") qırx gün keçdiyi və Şiraz camaatının Şeyx Sədi[1475] məzarını seyr (ziyarət) etməyə getdiyi zaman Sultan Əhməd Cövlanın oğlu Əmir Yusif bəy bir sıra böyük əmirlərlə, o cümlədən də Sufi Xəlilin oğlu İsmayıl bəylə və İsfahan hakimi Teyyüb ağa ilə birlikdə Qasım bəy Pornakın üstünə gəldi. Hövzi-Hərunda[1476] onlar arasında döyüş və vuruş baş verdi. Şirazlılar qalib gəldilər. İsmayıl bəy və Teyyüb ağa öldürüldülər. Əmir Yusif bəy isə fərar etdi. Ondan sonra Qasım bəy, Rüstəm bəyin yanına getdi. Görüşdən sonra padşahın və dövlət ərkanının istəyi belə oldu ki, bundan belə Qasım bəy Şiraz tərəfə getməsin. Lakin əmirlərin bəziləri pornak [tayfasına mənsub] olduqlarından[1477] [Qasım bəyi] himayə etdilər. Qasım bəy çoxlu xərc çəkdi və Fars əyaləti yenidən ona verildi. Amma onun vəziri olan Xoca Ruhulla Qəzvinini[1478] qətlə yetirdilər.

## 902-Cİ İLİN (09.09.1496 – 29.08.1497) HADİSƏLƏRİ

### Əhməd padşahın[1479] Rumdan padşahlıq arzusu ilə gəlməsi və Rüstəm padşahın öldürülməsi haqqında söhbət

Bu il Həsənəli Tərcani[1480] Ruma getdi və Sultan Bayəzidə ərz etdi ki: "Azərbaycan və İraq müqavimət və müdafiə ayağını müharibə meydanına qoya biləcək bir qoşundan xalidir. Əgər ali rəyiniz lazım bilərsə, o məmləkətin varisi olan Əhməd bəy ibn Uğurlu Məhəmməd ibn Həsən padşah müzəffər ordunun bir dəstəsi ilə o tərəfə yollansın. Çünki o məmləkətin fəthi asanlıqla müyəssər olacaqdır". Azərbaycan və İraq səltənəti Rum padşahının könlünə yatdığı üçün Əhməd bəyi daş ürəkli[1481] rumilərdən [ibarət] bir dəstə ilə Həsənəli Tərcaniyə qoşub yolladı. Onların gəlişi xəbəri Azərbaycan məmləkətində (şəhərlərində) yayıldıqda, türkman əmirləri vəfaslzlıq yolunu seçdilər və Əhməd bəyin tərəfinə keçdilər. Hüseyn bəy Əlixani, Rüstəm bə-

[1475] XIII əsrin məşhur İran şairi Şeyx Müslihəddin Sədi Şirazi.
[1476] Baroda nəşri: "Hövzi-Birun"; Məclis nüsxəsi: "Hövzi-Harun".
[1477] Bakı nüsxəsi: "Pornak əmirlərinin bəziləri orada olduqlarından".
[1478] Bakı nüsxəsi: "Xoca Abdullanı".
[1479] Məclis nüsxəsi: "Gödəcə Əhməd bəyin".
[1480] Baroda nəşri və Bakı nüsxəsi: "Tərxani".
[1481] Nuruosmaniyyə nüsxəsi: "dar ürəkli".

yin yaxınlarından olan Əbdülkərim bəy Ləlıni Sultaniyyə hüdudunda qətlə yetirib, həmin ilin ramazan ayının ilk günündə (03.05.1497) Əhməd bəyin adına xütbə oxutdu və sikkə kəsdirdi.

Elə ki Rüstəm bəy bu xoşagəlməz xəbəri aldı, çoxsaylı bir qoşun və şövkətli bir güruh ilə Əhməd bəyə mane olmaq üçün yola çıxdı və Araz çayı kənarında o iki ali məqamlı padşah, bəlkə də, iki kinli pələng bir-birinin qarşısında səf çəkdilər. Hər iki ordunun pəhləvanları və hər iki ölkənin qəhrəmanları nizəyə, qılınca və baltaya əl atıb bir-birinə həmlə etdilər. Toz-torpaqdan fələklərin gözü qaraldı. Qalibi məğlubdan, əzilmişi əzəndən ayırmaq mümkün olmadı. Döyüş dənizinin təlatümə gəldiyi həmin vaxtda Əhməd bəy vüqar lövbərini salladı. Hadisə Rüstəm bəyin dövlətinin ətəyinə əl vurduğu üçün o da həmin mövqedə mətanət ayağını dirəmişdi. Hər iki ordunun bahadırları və hər iki padşahın dilavərləri yenidən o iki sərdarın bayraqlarının kölgəsi altında toplanıb, cəsarətlə bir-birinin başına qılınc ("tiğü-şəmşir") vurdular.

Nəzm

"Qılıncın nəfəsi başlarda arx açdı,
İgidlər o arxlarla üzlərini yudular.
Döyüşçülərin üzərinə gürzlər elə yağdı ki,
Sən deyərdin ki, əbabil daş yağdırır".

Döyüş və toqquşma əsnasında Aybə sultan fitnəkar yalançılardan [ibarət] bir dəstə ilə ordunun səfini viran qoyub Əhməd bəyə qoşuldu. Ona görə də Rüstəm bəy dustaq edilərək varlıq dəftərinin vərəqlərini yoxluq küləyinə verdi (öldürüldü).

Mülkün şərikindən xatircəm olan Əhməd padşah hərəkət üzünü Təbrizə yönəltdi və səltənət taxtına oturub bargahının qübbəsini günəşə və aya yüksəltdi, bayrağının muncuğunu Əyyuqa[1482] çatdırdı. Qüvvətinin və şövkətinin çoxluğu ilə digər əmirlərdən üstün və müstəsna olan Hüseyn bəy Əlixani öz sinəsində Müzəffər Pornaka kin bəslədiyi üçün *onu qətlə yetirdi. Əhməd bəy [Müzəffər Pornakın] qısasını almaq üçün*[1483] buyurdu ki, onun (Hüseyn bəy Əlixaninin) həyat damarını amansız qılıncla kəssinlər. Mövlana Ziyai Ordubadi[1484] onun adına bir qəsidə demiş və Əhməd bəy də ona bir kisə qızıl bağışlamışdı. [Burada həmin qəsidənin] bir neçə beyti qeyd olunur:

Şeir

"O, lalə üzlü sərvə bənzəsə də,
Kimsə onu çəmənlikdə axtarmaz, məclisində axtarar.
Məclislərin ortasında "əlif" kimi dimdik dayanar,
Ondan ötrü ki, tamaşa etsinlər kişilər və qadınlar ona.
Onun ətrafında məclis iştirakçıları hala[1485] kimi görünərlər,
Çünki o, vətəni fələk olan ay kimidir məclisdə.
Ziya şahənşahın adını çəkdikcə,
Onun ağzından ləhzə-ləhzə nur şölələnir.
Aydın ürəkli yeganə şah Əhməd xanın,
Məclisinin şamını gördü çərxi-fələk və [həmin şamın altında] ləyən oldu.
Düşmən üçün əcəl gecəsinin qılıncını parlatdı,
Onun şölə saçan mizrağının ucu qan rənginə bulaşdı.
Günəş kimi tutdu yer üzünü qılıncla,
Onun gözəl taleyi ona gözəl bir dövlət verdi.
Ey şah, sənin dövründə üfüqlər başdan-başa şaddır,

[1482] Əyyuq – şimal yarımkürəsindəki Keçi bürcünün ən parlaq ulduzudur. Bu ulduzun göy üzünün ən yüksək nöqtəsində yerləşdiyinə inanıldığı üçün Şərq ədəbiyyatında ondan bir mübaliğə ünsürü olaraq istifadə edilmişdir *(İ.Pala. Ansiklopedik divan şiiri sözlüğü, s.48).*

[1483] Bakı nüsxəsi (v.15a).

[1484] İran alimi Ə.Nəvai bu şair haqqında belə yazır: "Ziyai təxəllüslü Şeyx Ziyaəddin – Ağqoyunlu Yaqubun müasiri idi. O, gəncliyində təhsil almaq üçün Herata getdi və Əmir Əlişirin qayğısı ilə əhatə olundu. Ondan sonra Sultan Hüseyn Bayqaranın və onun oğullarının xidmətində durdu və onları mədh etdi… Kürəkanilərin (Teymurilərin – N.M.) dövləti sarsıldığı zaman bu azərbaycanlı şair öz doğma vətəni Azərbaycana qayıtdı və h. 927-ci ildə (m. 1520-21) vəfat edənə qədər orada qaldı. O, qısa boylu, lakin ağıllı və dəqiq bir adam idi. Onun şeirləri daha çox tapmaca və müəmma tərzindədir" *(Nəvai, şərhlər, s.918).*

[1485] Halə – bəzən Ayın ətrafında görünən parlaq dairə.

Bircə mənim ürəyim kədərlidir və hüzünlüyəm.
Fəqirlikdən və yoxsulluqdan elə bir haldayam ki, ölümümü istəyirəm,
Bəlkə, bu yolla xilas olum cahandan və onun möhnətindən.
Əgər yüz batman buğdanı bir arpaya satsalar belə,
Allahın pak zatına and olsun ki, onu almağa acizəm".

### Sultan Hüseyn mirzə ilə Bədiüzzaman mirzənin müharibə etməsi

Bu il Bədiüzzaman mirzə öz atası Sultan Hüseyn mirzəyə yağı oldu. Onun qiyam qaldırması xəbəri Heratda yayıldıqda Sultan Hüseyn mirzə çoxlu qoşun və saysız güruh ilə Bəlxə doğru tələsdi. O tərəfdən də Bədiüzzaman mirzə bir dəstə dilavərlə döyüş meydanına gəldi. Pülçıraq dərəsinin ortasında iki qoşun bir-birinə yaxınlaşıb döyüşə başladılar. Bədiüzzaman mirzənin gözü atasının fatehlik bayrağına sataşdıqda, idbar üzünü fərar vadisinə çevirib böyük məşəqqətlə özünü coşqun dənizin təlatümündən kənara çıxardı. Hüseyn mirzə çoxlu qənimətlə darüssəltənə Herata qayıtdı.

### Ölümlər

Sultan Hüseyn mirzənin oğlu Şahqərib mirzə bu il qəfil bir illətdən öldü.

Rüstəm padşah ibn Maqsud bəy ibn Həsən padşah olduqca səxavətli idi. Ağqoyunlu və Qaraqoyunlu sultanlarından heç biri haqqı çatan adamlara onun qədər soyurğal və vəzifələr verməmişdi. [Yuxarıda] qeyd edildiyi kimi, bu il o, qətlə yetirildi. Onun möhüründə [bu sözlər] nəqş edilmişdi:

Beyt

"Ədalət göstər ki, ədalətlə qəhrəman olasan (ad çıxarasan),
Sultan Həsənin oğlu Maqsudun Rüstəmi".

Səltənət əyyamı beş il, altı ay oldu. Məmləkəti: İraqi-Əcəm, İraqi-Ərəb, Azərbaycan, Fars və Diyarbəkr idi.

## 903-CÜ İLİN (30.08.1497 – 18.08.1498) HADİSƏLƏRİ

### Aybə sultanla Əhməd padşahın müharibə etməsi haqqında söhbət

Əhməd padşah, Hüseyn bəy Əlixanini qətlə yetirdikdən və tamam-kamal həşəmətlə, səadətlə darüssəltənə Təbrizdə səltənət taxtı üzərinə oturduqdan sonra Aybə sultana olan lütfünün azlığından Kirman əyalətini ona verib onu o tərəfə yolladı və Şiraz valisi Qasım bəy Pornakı çağırmaq üçün elçi göndərdi. Qasım bəy elçiyə ehtiram göstərsə də, son dərəcə vahimələndiyi üçün o fikirdə idi ki, bir tərəfdən yol tapıb aradan çıxsın. Elə bu əsnada xəbər yetişdi ki, Aybə sultan bir dəstə əsgərlə Kirmana gedir və Süleymanın – ona salam olsun – anasının şəhidgahının ("Məşhədi-madəri-Süleyman əleyhissəlam")[1486] ətrafına çatıb. Qasım bəy onu qarşılayıb Şiraza gətirdi və Əhməd padşahın elçisini tutub, cümə günü İbrahim adını daşıyan Aybə sultanın adına xütbə oxudular. Onlar qərar verdilər ki, Yaqub padşahın oğlu Sultan Muradı Şirvandan gətirib səltənətə əyləşdirsinlər və hər ikisi birlikdə vəkil olsunlar. Camaatdan, xüsusən də əsərlər müəllifi olan Mövlana Cəlaləddin Məhəmməd Dəvvanidən və seyid soylu, nəqiblik (nəqabət) sahibi Əmir Qiyasəddin Mənsur oğlu Əmir Sədrəddin Məhəmməddən çoxlu qızıl yığdılar. Ondan sonra həmin iki bədbəxt bir-biri ilə ittifaqda hərəkət bayrağını İsfahan səmtinə yüksəltdilər.

Onların tüğyanının xəbəri Əhməd bəyə çatdıqda izdihamlı və təcrübəli bir qoşunla o iki yaramazı dəf etmək üçün İsfahana yollandı. Çaharşənbə günü, rəbiüssani [ayının] 17-də (13.12.1497) köhnə Xocahəsəndə ("Xocahəsəni-mazi") onlara yetişdi[1487]. Aybə sultanın qoşunundan çoxsaylı bir dəstə Əhməd padşahın ordusuna qoşuldu. Aybə sultanın müqavimət qüvvəsi olmadığından, tuğunu (bayrağını) endirib qaçmaq istəyirdi. Əhməd bəyin adamları müxaliflərin zəifliyini məlum etdikdə, padşahın ətrafından uzaqlaşıb qarətçiliklə məşğul olmağa başladılar. Aybə sultan fürsəti qənimət bilib özünü padşaha yetirdi və onu izzət zirvəsindən zillət

[1486] Şiraz – İsfahan yolu üzərində yerləşir *(Seddon, şərhlər, s.218).*
[1487] Bu döyüş İsfahandan 60 mil aralıda, Borucerd yolu üzərində yerləşən kiçik bir ovalıqda baş vermişdir *(Seddon, şərhlər, s.218).*

torpağına saldı, başını bədənindən ayırıb nizənin ucuna taxaraq buyurdu ki, sevinc nağarası vursunlar. Əhməd padşahın ordusu bunu görüncə fərar [etməyə] qərar verdi.

Şeir

“Dikbaş Əhməd şahın döyüşçüləri,
Qarşılarında tutdular uzun bir yolu.
Qənimət bildilər tələsik qaçmağı,
Sərsəm oldular lap tüstü kimi”.

Elə ki Aybə sultanın qaliblik sübhü xoşbəxtlik üfüqündən çox məşəqqət çəkmədən doğdu və səadət mehi onun bayrağının pərçiminə əsdi, Qum qışlağına üz tutub, orada olmayan Sultan Muradın adına sikkə kəsdirdi və xütbə oxutdu. Onu gətirmək üçün Şirvana gözəl danışan qasidlər göndərdi. Qumda bir bargah tərtib edərək o bargaha bir kürsü qoydu və o kürsünün başına bir sarıq bağlatdırdı. Hər səhər əmirlərin sultanlara mülazimlik etdiyi qaydada oraya gedərdi və işlərin sərəncam olunması ilə məşğul olub böyük süfrə açardı.

Həmçinin bu ilin yazında o, hərəkət yüyənini Təbrizə yönəltdi. O mərdimazarın həmin hüduda çatmasından öncə bir dəstə adam Sultan Muradı Şirvandan çıxarıb ona (Aybə sultana) qarşı düşmənçilik mövqeyini tutdular. Aybə sultan onlarla döyüşüb qalib gəldi, Sultan Muradı Ruyindez qalasında[1488] məhbus edərək onun anası ilə evləndi və Əlvənd bəy ibn Yusif bəy ibn Həsən padşahı Təbrizə gətirib səltənət taxtına oturtdu.

**Sultan Hüseyn mirzənin Bədiüzzaman mirzə ilə ikinci dəfə çəkişməsi**

Bu il Sultan Hüseyn mirzə Üləngi-Neşin yaylağında[1489] vəzirlərin günahları ilə bağlı sorğu-sual apararkən onun əsgərlərinin pərakəndə halda olduğu haqqında xəbər Qəndəhardakı Bədiüzzaman mirzəyə çatdı. O, Əmir Zünnun Ərğunun oğlu Şüca bəylə ittifaqda dörd min nəfər yaxşı silahlanmış süvari ilə Qəndəhardan qələbə nişanlı orduya tərəf sürətlə yürüdü və altı gün ərzində Səbzəvara çatdılar. Fəridun Hüseyn mirzə bir sıra əmirlərlə Səbzəvar qalasına sığınıb hökmdarın dərgahına bir çapar göndərdi. Cümə gününün çaşt vaxtında, şəvval [ayının] 10-da (01.06.1498) bu möhnətli xəbər o alinəsəb padşaha çatdı. O, Herata yasavullar[1490] göndərdi ki, Əmir Əlişir Heratda atlanıb, məhəllələri dolaşaraq tapa bildiyi əsgərləri orduya göndərsin. Əmir Əlişir əmrə əməl etdi. Həmin günün axırında Əmir Məhəmməd Vəli bəy, Ömər bəy və Əmir Baba Əli Astarabad tərəfdən gəlib çıxdılar və hökmə əməl edib orduya yollandılar. Onların gəlişindən öncə zəfər nişanlı ordunun qaravulları xəbər gətirdilər ki, Bədiüzzaman mirzə qalanı mühasirə etməyə iltifat göstərməyərək ildırım və külək sürəti ilə məsafələri qət edir. Bu səbəbdən Sultan Hüseyn mirzənin iztirabı artdı. Əgər o gecə Bədiüzzaman mirzə orduya çatsaydı, onun qalib gəlməsi mümkün idi. Amma o, təkid etməyərək ordunun ətrafında yuxuya getdi. Sübh açılan kimi Bədiüzzaman mirzə və Şüca bəy yekdil bir ordu ilə və cövşən parçalayan mübarizlərlə kin qılıncını sıyırıb, döyüş və savaş bayraqlarını yüksəldərək hərb meydanına gəldilər.

Digər tərəfdən də Sultan Hüseyn mirzə özünün qiyamət əlamətli qoşununun tərtibi ilə məşğul oldu. Elə bu vaxt Əmir Xosrovşahın üsyanı ucbatından Hisari-Şadmandan çıxıb kömək almaq ümidi ilə yüksək şanlı padşahın dərgahına doğru üz çevirmiş Sultan Məsud mirzə beş yüz nəfərlə gəlib çatdı. Eyni zamanda Əmir Məhəmməd Vəli bəy, Ömər bəy və Əmir Baba Əli Astarabad tərəfdən, Fəridun Hüseyn mirzə, Əmir Əbdüllətif və b. əmirlər sürətli yürüşlə Səbzəvar ətrafından gəlib zəfər şüarlı orduya qoşuldular. Bədiüzzaman mirzə və Şüca bəy öz təsəvvürlərinin əksinə, [Sultan Hüseyn] mirzənin ordusunun piyada və süvarilərlə dolu olduğunu gördülər. Onlar son dərəcə dəhşət və çarəsizlik üzündən döyüş alətlərinə əl atdılar.

---

[1488] Ruyindez – “tunc qala” deməkdir. XIV əsr coğrafiyaçısı Həmdulla Qəzviniyə görə, bu qala Savalan dağının zirvəsində yerləşirdi *(Хамдаллах Казвини. Нузхат ал-Кулуб: материалы по Азербайджану, пер. З.М.Буниятова и И.П.Петрушевского. Баку, 1983, с.44).* Lakin bu adda qalanın Təbriz yaxınlığında və Marağanın 3 fərsəxliyində yerləşməsi barədə fikirlər də mövcuddur *(Seddon, şərhlər, s.218).*

[1489] Herat yaxınlığındadır *(Seddon, şərhlər, s.218).*

[1490] Yasavul – “yasa” (qayda, qanun) sözündən alınmışdır. Yasavullar şahın olduğu yerdə qayda-qanun yaradırdılar. “Söhbət yasavulları” adlanan yasavullar yalnız hörmətli əmirlərin oğullarından ibarət ola bilərdilər və Səfəvilərin erkən zamanlarında onların sayı səkkiz-doqquz nəfərdən çox olmazdı. Şahın xüsusi məclislərində onlar eşikağasılarla birlikdə xidmət göstərər, ictimai yığıncaqlarda isə şahın bərabərində durardılar, məclisə də eşikağasılar qulluq edərdilər. Həm yasavullar, həm də eşikağasılar ali divanın eşikağasıbaşısına tabe idilər *(Mirza Səmia. Təzkirətül-müluk, s.27; V.F.Minorsky. “Tadhkirat al-Muluk”, s.133; О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.268; Z.Veliyeva. Safevî devlet teşkilatı, s.230-232).*

Şeir

“Bağırtılar qopdu hər iki tərəfdən,
İki kin dəryasının ağzı köpükləndi.
Zəhərli və iti oxlar yağmağa başladı,
Bahardakı göy qurşağının yağışı kimi.
İki tərədən dalbadal ox atıldı,
Yer üzündə qan axmağa başladı”.

Savaş meydanından tozanaq qalxdı və döyüş atəşi alovlandı. Axırda İlahi lütf və əbədi hüsn-rəğbət Sultan Hüseyn mirzənin halına şamil olub, fəth və zəfər mehi onun səadətli bayrağına əsdi, Zəmindavər və Qəndəhar camaatının əhval səhifələri üzərində məğlubiyyət əlamətləri göründü. Bədiüzzaman mirzə vuruşmadan aciz qalıb Qur dağları tərəfə yönəldi. Bir dəstə əmirlər və əsgərlər onu təqib etdilər. Əmir Ömər bəy ona çatdı. Əmir Yusif [ibn] İsfəndiyar, Bədiüzzaman mirzənin nizəsini əlindən alıb Əmir Ömər bəyin ağzından elə vurdu ki, bir neçə dişi sındı və atdan başı aşağı yıxıldı. Gəda Əli Miraxur cəsurluğunun çoxluğu üzündən özünü Şüca bəyə yetirdi. Şüca bəy bir qılınc zərbəsi ilə onu elə hala saldı ki, döyüşməyə macal tapmayıb geri döndü. Bədiüzzaman mirzə getdikdən sonra Hüseyn mirzə qələbə və zəfərlə Herat taxtgahına qayıtdı.

## Ölümlər

Əhməd bəy ibn Uğurlu Məhəmməd ibn Həsən padşah son dərəcə rəiyyətpərvər bir adam idi. Onun zamanında özbaşınalıq qapıları bağlandı və şərab içməyə mane olundu, [bu iş] hətta əmirlərə də qadağan edildi. Üləmaya son dərəcə hörmət göstərirdi. Onun məclisində elmi mübahisələr baş verirdi və özü də [bu mübahisələrdə] iştirak edirdi. Mövlana Cəlaləddin Məhəmməd Dəvvaniyə və Mir Sədrəddin Məhəmmədə hökm[1491] əvəzinə məktub (“kitabət”) yazardı və məktubun arxasına öz möhürünü vurardı. Fikri o idi ki, ədalət qanunu çıxarıb (qəbul edib) türklərin əlini acizlərin və rəiyyətin üzərindən çəksin. Bu səbəbdən idi ki, türklər zahirən onun əmrinə itaət etsələr də, amma ürəklərində onun əleyhinə idilər. Bu məna ona bəlli idi və hər neçə gündən bir, birisini qətlə yetirirdi. Amma qənaətcillik onun təbiətinə hakim kəsilmişdi. Keçmiş sultanların camaata bağışladıqları soyurğalların hökmlərinin icrasına əngəl törədirdi. Bu davranış ona uğur gətirmədi və daha öncə qeyd edildiyi kimi, həmin ilin qışında qətlə yetirildi. Səltənət müddəti altı aydır. Üzü qırmızı və ağ, boyu alçaq, əl-ayağı qısa idi. Ona görə də Gödəcə Əhməd adlandırılırdı. Şairlərdən biri bu barədə demişir:

Beyt

“Rum kələmini ki, cahan sultanı etmişdilər,
Dey (qış) vaxtı gəldi və onu torpaqda gizlətdilər”.

Möhürünün nəqşi:

Beyt

“Məzlumun quru dodağı xoşluqla gülsün artıq,
Çünki biz zalımın kökünü qazıyacağıq”.

Əmir Qiyasəddin Mənsurun oğlu Əmir Sədrəddin Məhəmməd cümə günü, sözügedən ilin ramazan [ayının] 12-də (04.05.1498) vəfat etdi. Ömrü yetmiş beş il idi. Gənclik əyyamında Mövlana Qivaməddin Gülbarinin yanında elmlər üzrə təhsil almışdı. Kamal dərəcəsinə tərəqqi edib Şirazda bir ev[1492] tikdirmişdi və orada müəllimlik edirdi. Mübarək qələminin məhsulu olan əsərlər sırasında bunlar vardır: “Haşiyeyi-əcədi-təcrid” (“Ən yeni təcrid haşiyəsi”), “Haşiyeyi-təcrid” (“Təcrid haşiyəsi”), “İsbati-vacib” (“Vacibin isbatı”), “Haşiyeyi-mətale” (“Mətlələr haşiyəsi”), Haşiyeyi-şəmsiyyə” (“Şəmsiyyə haşiyəsi”) və “Risaleyi dər təhqiqi-ülum” (“Elmlərin təhqiqinə dair bir risalə”).

Həmçinin bu il Şiraz hakimi Mənsur bəy Pornak vəfat etdi.

[1491] Məclis nüsxəsi: “pərvanəçə”.
[1492] Bakı nüsxəsi: “mədrəsə”

Fazil Nöqtəçioğlu Rumdan gəlmişdi və Əhməd padşah ona münasibətdə iradət təriqi ilə (mürid kimi) davranırdı. Əhməd padşahın öldürüldüyü yerdə o da öldürüldü.

"Rövzətüs-səfa" ("Səfa bağçası") tarixinin müəllifi olan tarixçi Əmir Xand (Mirxond) Məhəmməd həmin ilin zilqədə [ayının] 2-də (22.06.1498) vəfat etdi. Ömrü altmış altı il idi.

Həmçinin bu il Bədiüzzaman mirzənin oğlu Məhəmməd Mömin mirzə babası Sultan Hüseyn mirzənin əmri ilə qətlə yetirildi.

## 904-CÜ İLİN (19.08.1498 – 07.08.1499) HADİSƏLƏRİ

### Məhəmmədi *mirzənin öz qardaşı*[1493] Əlvənd bəylə müharibəsi haqqında söhbət

Məhəmmədi mirzə ibn Yusif mirzə ibn Həsən padşah, Aybə sultana qarşı döyüş günündə Əhməd bəyin xidmətində idi. Əhməd bəy öldürüldükdən sonra o, Yəzdə getdi. Oranın hakimi Murad bəy Bayandur, Əşrəf bəylə birlikdə onu padşah edib Şiraza yönəldilər. Qasım bəy Pornak qorxmaz dilavərlərlə onların qarşısına çıxdı. Nayin ətrafında hiddət və kinlə dolu olan o iki qoşun arasında böyük bir savaş baş verdi. Çalış-vuruşdan sonra Qasım bəy məğlub oldu. O, çoxlu məşəqqətlə özünü Sayınqalaya çatdırdı və Aybə sultanın yanına yaxşı nitq qabiliyyətinə malik qasidlər göndərib yardım dilədi. Məhəmmədi mirzə Şiraza gəlib, oranın idarəçiliyini Mənsur bəy Əfşara tapşıraraq qoşun və yaraqla İraq səmtinə hərəkət etdi. İsfahanı tutduqdan sonra Rey tərəfə yollanıb orada qışlaq etdi. O əsnada Aybə sultan, Əlvənd bəy və Qasım bəy İraqa gəldilər. Məhəmmədi mirzə onlardan qaçaraq Əmir Hüseyn Kiya Çəlavinin yanına getdi. Aybə sultanla Əlvənd bəy Qumda qışlaq etdilər, Qasım bəyi Şiraza yolladılar, Aybə sultanın qardaşı Gözəl Əhmədi isə əksər əmirlərlə və ağır qoşunla Vəramin qışlağına göndərdilər.

Bu əsnada Mirzə Məhəmmədi, Əmir Hüseyn Kiya Çəlavi ilə ittifaqda Gözəl Əhmədə gecə basqını etdi və onun bütün yaraq-əsləhəsini ələ keçirdi. Gözəl Əhməd pərişan və lüt-üryan halda Aybə sultanın yanına gəldi. Əlvənd bəy qışın ortasında Azərbaycana getdi. Məhəmmədi İraqda qüvvətləndi və onun başına çoxlu qoşun və saysız güruh cəmləşdi. O, tam sürətlə onların ardınca yola çıxdı. Əzizkəndində[1494] Əlvəndlə Məhəmmədi arasında böyük bir savaş baş verdi. Məhəmmədi [Allahın] sonsuz köməyi sayəsində qalib gəldi. Aybə sultan həlak torpağı üzərinə düşdü. Əmirzadə Əlvənd məhdud bir dəstə ilə Diyarbəkrə qaçdı. Oranın valisi Qasım bəy[1495] Əlvənd bəyi qarşılayıb onu səltənət taxtına oturtdu. Məhəmmədi isə Azərbaycan məmləkətinin gəlinini ağuşuna çəkib darüssəltənə Təbrizdə hökumət bayrağını yüksəltdi. Bu əsnada Əlvənd bəy Qasım bəydən ayrılıb Təbrizə hərəkət etdi. Məhəmmədi mirzə qardaşının hərəkətindn xəbər tutub Sultaniyyəyə tərəf tələsdi. Əlvənd bəy darüssəltənə Təbrizdə əyləşdi və Lətif bəyi vəkil [təyin] etdi.

Həmçinin bu il Mənsur bəy Əfşar bir dəstə yaramazla birlikdə Şiraza yollandı. Qasım bəy Pornak türklərdən [ibarət] bir dəstə ilə onu qarşılamağa tələsdi. Şulistanda həmin iki saysız-hesabsız qoşun bir-biri ilə döyüşdü. Çoxlu vuruşmadan və çarpışmadan sonra əfşar dilavərləri qalib gəlib pornakların çoxunu həlak torpağı üzərinə saldılar və Qasım bəyi əsir tutub Şiraza yönəldilər. İstəxr qalası ətrafında Qasım bəy fərar edib özünü qalaya saldı və düşmənlərinin əlindən xilas oldu.

### Halvaçeşmə mövqeyində Sultan Hüseyn mirzənin öz oğulları ilə müharibə etməsi

Həmçinin bu il Əbülmöhsün mirzə və Köpək mirzə öz ataları Sultan Hüseyn mirzəyə müxalif çıxmağa qərar verdilər. Elə ki bu möhnətli xəbər alinəsəb hökmdarın qulağlna çatdı, müzəffər bayrağını Mərvə doğru yüksəltdi. Əbülmöhsün mirzə Mərvdə möhkəmləndi. Padşahın qoşunları Allahın köməyi ilə Mərvi dairə kimi əhatəyə aldılar. Mühasirə dörd ay davam etdikdən sonra Əbülmöhsün mirzə yalvar-yaxar etməkdən başqa çarə görmədi. O, atasının yanına adam göndərib ərz etdi: "Əgər o həzrət bu bəndənin təqsirlərini bağışlayarsa və Herata tərəf gedərsə, ayağımın əvəzinə başımı yerə qoyaraq (hərfən: "başımı qədəm edərək"), dünyanın pənahı olan dərgahın torpağını öpməyə gələcəyəm". Padşahın mərhəməti üzündən şahzadənin xahişi izzətlə qəbul edildi. Hökmdarın məiyyəti Mürğaba doğru hərəkətə başladı. Bu əsnada Əbülmöhsün

---

[1493] Bakı nüsxəsi (18b).
[1494] Əzizkəndi – Savucbulaqdan 35 mil şərq və cənub-şərq istiqamətində yerləşir *(Seddon, şərhlər, s.219).*
[1495] Tehran nəşri: "Dayı Qasım bəy"; Bakı nüsxəsi: "Ayı Qasım"

mirzə və Köpək mirzə [bir-birinə] elçilər və məktublar göndərdilər və padşahla müharibə etmək əzmi ilə Əbivərd ətrafında birləşdilər.

Bu xəbər Babaxakidə[1496] alinəsəb padşahın ərzinə yetişdikdə, səhhətinin zəifliyi ucbatından bir kəcavəyə otutub onlara tərəf yollandı. Əbülmöhsün mirzə ilə Köpək mirzə atalarının gəlişindən xəbər tutub Nisa tərəfə tələsdilər. Sultan Hüseyn mirzə onların qaçması barədə məlumat aldıqda Müzəffər Hüseyn mirzəni, Heydər Məhəmməd mirzəni, İbnihüseyn mirzəni və Əmir Məhəmməd Bərəndüq Barlası onların ardınca göndərdi. Onlar Halvaçeşmədə[1497] qarşı-qarşıya gəldilər. Müzəffər Hüseyn mirzə qoşunun mərkəzində yerləşib, sağ cinahı ("meymənə") Heydər Məhəmməd mirzəyə tapşırdı və sol cinahı ("meysərə") İbnihüseyn mirzəyə həvalə etdi. O tərəfdən Əbülmöhsün mirzə qoşunun mərkəzində dayandı, Köpək mirzə isə sağ cinahda ("bərangar") qərar tutdu. O zaman ad-san qazanmaq istəyənlər döyüşə əl atdılar. Qırğın və çalış-vuruş atəşi elə bir növlə alovlandı ki, onun tüstüsünün təsiri böyük çillənin şiddətli şaxtasının kürəsini qaynatdı və onun şöləsi ayın xırmanını yandırıb fələyin vücuduna təsir etdi. Qızıl barmaqlardan açılan hər ox ("xədəng") bir pəhləvanın canına qəsd edirdi və bir aydın ürəklinin əlindən pərvaz edən hər ox quşu bir əmirin sinəsinin fəzasında bir qapı açırdı.

Şeir

"Polad quyruqlu çubuq quşlar (oxlar) üzündən,
Havada günəşin yolu daralmışdı.
Sinə ox ucları ilə dolu sandığa çevrilmişdi,
Çünki onun içində hədsiz sayda ox ucu qalmışdı".

Şahzadələrin sol cinahından İbrahim Tərxan qələbə nişanlı ordunun sağ cinahına həmlə etdi. Heydər Məhəmməd mirzə ona tab gətiməyib yüyənini fərar vadisinə çevirdi. Köpək mirzə sağ cinahdan İbnihüseyn mirzəyə basqın etdi və onu məğlubiyyətə uğratdı. Mərkəzdə duran Müzəffər Hüseyn mirzə fərar etmək istədi. Əmir Sultanəli pəhləvanlığının və qəhrəmanlığının çoxluğu üzündən şahzadənin atının yüyənini tutub onun belə bir hərəkət etməsinə mane oldu və dedi:

- Əgər döyüş meydanı zati-alinizdən xali olarsa, müxaliflər cəsarətlənərlər və bu qaçış o həzrətə (Sultan Hüseyn mirzə Bayqaraya) sirayət edər.

Müzəffər Hüseyn mirzə yerində möhkəm dayandı. Bu əsnada sağ və sol cinahlardan qaçanlardan xəbər tutan Sultan Hüseyn mirzə kəcavədən çıxıb, səhhətinin zəifliyinə baxmayaraq, ata minərək döyüş meydanına tələsdi.

Şahzadələrin gözü Sultan Hüseyn mirzənin bayrağına sataşdıqda onların ürəklərinə sarsıntı yol tapdı və o iki sərdardan hər biri bir tərəfə qaçdı.

**Ölümlər**

Bu il şair Əmir Hüseyn Müəmmayi[1498] ishal xəstəliyindən vəfat etdi və şərəfli İxlasiyyə mədrəsəsinin günbəzində dəfn edildi. Şairlərdən biri onun tarixi barəsində demişdir:

Nəzm

"Gözəl xasiyyətin məzhəri Mir Hüseyn,
Ki əcəl qırdı onun həyatını.
Cənnətə doğru köçüb getdi,
Dünya hadisələrindən nicat tapdı.
Rəhmət nuru çün ona nazil oldu,
"Rəhmət nuru" oldu vəfatının tarixi"[1499].

Əsərləri cümləsindən "Fənni-müəmma" haqqında bir risaləsi var.

---

[1496] Babaxaki – Heratdan 13 fərsəx şərqdə yerləşir *(Seddon, şərhlər, s.219)*.
[1497] Halvaçeşmə – İranın şimal-şərqində, Türkmənistanla həmsərhəd Şirvan şəhristanının Quşxanə dehistanında bir kənd.
[1498] Əslən nişapurlu bir seyiddir. Müəmma sənətində yüksək səviyyəyə çatmışdı *(Nəvai, şərhlər, s.930)*.
[1499] "Nuri-rəhmət" = 904 h.

## 905-Cİ İLİN (08.08.1499 – 27.07.1500) HADİSƏLƏRİ

### Sultan Muradın Məhəmmədi mirzə ilə müharibə etməsi

Bu il Gözəl Əhməd Bayandurla Fərruxşad bəy Bayandur Təbrizə, Sultan Muradın yanına getdilər və onu götürüb Şiraza hərəkət etdilər. Qasım bəy İstəxr qalasından çıxıb onlara qoşuldu və Şirazın aran yerindən çoxlu mallar toplayıb onlara verdi. Bu xəbər Məhəmmədi mirzəyə çatdıqda çoxlu qoşun və saysız məiyyətlə onlara qarşı hərb etməyə yollandı. Sultan Murad izdihamlı və qaniçən ordu ilə birlikdə yüz izzət və dəbdəbə ilə darülmülk Şirazdan İsfahana irəlilədi. O iki izdihamlı ordi və o iki coşqun dəniz Kərüləngdə bir-biriləri ilə qarşılaşıb, döyüşə və vuruşa hazır olaraq səf tərtib etdilər. Hər iki tərəfin cavanları və yeniyetmələri bahadırcasına həmlələr etdilər və qılıncların camından ölümün acı şərabını bir-birinə içirdilər. O əsnada Piri bəy Əfşar aslan ovlayan igidlərdən [ibarət] bir dəstə ilə Qasım bəy Pornaka həmlə etdi. O, döyüş meydanına arxasını çevirib ta Şiraza qədər heç yerdə dayanmadı. Döyüş və vuruş zamanı Sultan Muradın tuğu (bayrağı) yerə düşdü. Pəhləvan Şahi[1500] pəhləvanlığının və qəhrəmanlığının çoxluğu üzündən onu götürdü və Sultan Muradın fərar edən adamları o bayrağın kölgəsinə cəmləşdilər. Baxıb gördülər ki, Məhəmmədi mirzə qoşunsuz və məiyyətsiz halda [təkbaşına] bayrağın (ələmin) altında dayanmışdır. Ona görə də Sultan Murad hiddətli bir aslan kimi qorxmaz mübarizlərdən [ibarət] bir dəstə ilə həmlə edib Məhəmmədi mirzənin dövlətinin üzünə bədbəxtlik tozunu səpdi. Onun ordusu savaş meşəsinin aslanları və hərb dənizinin nəhəngləri (timsahları) olsalar da, müqavimətdən aciz qalıb qaçmağa üz qoydular. Məhəmmədi mirzə qətlə yetirildi. Piri bəy Əfşar və Əşrəf bəy də ölüm şərbətini içdilər və onun əmirləri pərən-pərən düşdülər. Pir Əli Savəni zəbt etdi. Pir Məhəmməd Qumda yerləşdi. Qaya bəy Kaşanda məskunlaşdı. Sultan Murad xəbər aldıqdan sonra əlli min süvari və piyada ilə Savəyə gəldi. Pir Əli bəy şəhərdə möhkəmləndi. [Sultan Murad] onu əlli günə qədər mühasirədə saxlasa da, qətiyyən muradına çatmağa nail ola bilmədi. [Pir Əli] ortaya qasidləri salıb məsələni sülhlə həll etməyi qərara aldı. Onun oğlu Abdal bəy qaladan çıxıb [Sultan Muradın] mülazimi oldu və Sultan Murad köç edib Azərbaycana yollandı. Əmirzadə Əlvənd onu qarşılamaq (qarşısını kəsmək) üçün Əbhər ətrafında dayandı.

Bu əsnada Baba Xeyrulla adlı xeyirxah bir dərviş o iki yüksək məqamlı padşahla görüşüb hər ikisinin ürəyini sülhə və səfaya meyilləndirdi. Qərara alındı ki, Qızılüzən çayı o iki igidin ölkələri arasında sərhəd olsun, tamam Azərbaycan, Arran və Diyarbəkr vilayəti Əmirzadə Əlvəndə aid olsun, İraq, Fars və Kirman məmləkəti isə Sultan Murada məxsus olsun. Ondan sonra Əlvənd bəy Təbrizə getdi. Sultan Murad isə Qəzvində qışlaq etdi. Pir Əli bəy və Pir Məhəmməd bəy onun hüzuruna gəldilər və qəbul edildilər. Mənsur bəy Əfşar öz oğulları ilə Sultan Muradın xidmətinə gəlib təqsirlərinin bağışlanmasını istədilər. Sultan Murad tuğ qaldıran Pəhləvan Şahini çağırdı və dedi:

- Məndən nə istərsən?

O, cavab verdi:

- Nətənz kəndlərindən olan Milazcərd kəndinin[1501] daruğalığını [istəyirəm].

Pəhləvan iki il orada daruğalıq etdi. Bir şəxs ondan sual etdi:

- Nə üçün əmirlik istəmədin?

O, cavab verdi:

- Atam Milazcərddə əkinçi olub, mən isə orada daruğa oldum. *Allah bərəkət versin*[1502]. Bu, mənə bəsdir.

### İsgəndər şanlı xaqanın Lahicandan gəlməsi, onun Gögçə-dəngizə getməsi və Sultan Hüseyn Barani ilə görüşməsi

Bu il İsgəndər şanlı xaqan qərara gəldi ki, Lahicandan darülirşad Ərdəbilə getsin və ali məqamlı əcdadlarının fəthlərlə dolu ruhundan yardım diləyib mülkü bidət əhlindən alsın. Yüksək məqamlı xaqan məşvə-

---

[1500] Bakı nüsxəsi: "Pəhləvan Şahin".
[1501] Hazırda Nətənz yaxınlığındakı bu kənd Milacərd adlanır *(Nəvai, şərhlər, s.933)*.
[1502] Bakı nüsxəsi (21b).

rətdən sonra əhli-ixtisasdan[1503] birini rüxsət tələb etmək üçün əyalətin pənahı olan Karkiya Mirzə Əlinin yanına göndərdi. Karkiya onun yaşının kiçikliyi, ordusunun azlığı və düşmənlərinə tərəfdar və yardımçı olanların çoxluğu üzündən İsgəndər şanlı xaqanı bu fikirdən daşındırmağa, nəsihətlər və öyüdlərlə o camaatı bu istəkdən döndərməyə çalışır, öz sözünün doğruluğunu əsaslandırmaq üçün dəlillər və sübutlar irəli sürürdü. Amma onun bu təşəbbüsləri heç bir nəticə vermədi. Bir dəfə [İsgəndər şanlı xaqan] özü şəxsən Mirzə Əli ilə görüşüb, qarşılaşma zamanı eyni məsələni dilə gətirdi və o cənab (Karkiya Mirzə Əli) hərəkatın təxirə salınmasında israr edərək dedi:

Şeir

“Əl çək bu iddiadan, əl çək,
Yüyənini bu həvəsin yolundan geri çək!
Bu iddia barədə ətraflı düşünməyi özünə peşə et,
Öz işinin sonunu əndişə et!
Ehtiyatlı ol ki, dünya vəfadar deyil,
Sən uşaqsan, sənin bu işi görən vaxtın deyil.
Sənin [ömrünün] sübh çağı hələ indi açılır,
Halbuki bu işlərə yalnız gündüz vaxtı münasibdir.
Pərdə arxasındadır sənin sirrin hələ,
Gizlənib yumurtada sənin qartalın hələ.
Bu həvəsi etmə, qoy işin vaxtı gəlsin,
Bahar fəsli olmadan yasəməni tapmazsan.
Sədəfin bətninə dolan qətrələr,
Yetişmədən inci ola bilməzlər.
Səbirli olmaq sultanların xüsusiyyətidir,
Necə ki, tələskənlik şeytanın işidir”.

Əlbəttə, bundan bir fayda hasil olmadı və ona rüxsət şərəfi verildi. İsgəndər şanlı xaqan hərəkət yüyənini Lahicandan Ərcüvan[1504] tərəfə çevirdi. Karkiya Mirzə Əli yekdillik yolunun yolçusu olan bir dəstə ilə ali məiyyəti iki fərsəx yol boyunca müşayiət etdi və [daha sonra] icazə alıb geri qayıtdı.

İsgəndər şanlı xaqan Deyləmanda[1505] cah-calalla dayandı və oradan Taroma tələsdi. Taromda səadətli çadırlarını qurduqdan sonra qalibiyyətli əsgərlərin əhvalına nəzər salıb, Rum və Şam sufilərindən təxminən min beş yüz nəfərin müzəffər üzənginin mülazimi olduğunu gördü. Onun ətirli ürəyi Əmir Hüsaməddindən narahat idi. Çünki [Əmir Hüsaməddinin] xilaf və tərslik yolunun yolçusu olduğu deyilirdi. Bu üzdən [İsgəndər şanlı xaqan] Taromdan Xalxala gedərək Büridə[1506] kəndində dayandı. Ertəsi gün Şamlu tarlasına endi və Xalxalın Güzar[1507] kəndində dayandı. Ərzin zirvəsinə (İsmayıla) [xəbər] çatdı ki, adı çəkilən tarlada qovun bostanı var və o [qovunlar] olduqca şirin və dadlıdır. İsgəndər şanlı xaqanın qovuna meyli çox olduğu üçün bir neçə gün orada qaldı. Həmin mənzildə Şeyx Qasım öz qüvvət və qüdrətinin fövqündə olan bir ziyafət verdi. Belə ki, digər yeməklərdən başqa, qırx qoyun qızardılmışdı. Oradan köç edib Xalxalın Küvəri[1508] kəndində, Sultan Əli padşahın tuğaçısı olmuş və Xüləfa bəy [adı] ilə tanınmış Məlik Müzəffərin evində cah-calalla dayandı və təxminən bir ay orada qaldı. Daha sonra Ərdəbilin Səsabad[1509] kəndinə gəldi və orada qaldı. Oradan Alaruq[1510] kəndinə tələsdi və oradan da [hərəkət edərək] böyük şeyxlərin müqəddəs astanasını təvaf

---

[1503] Əhli-ixtisas - Hüseyn bəy Şamlu, Abdal bəy Dədə, Xadim bəy Xüləfa, Rüstəm bəy Qaramanlu, Bayram bəy Qaramanlu, İlyas bəy Ayqutoğlu Xınıslu və Qara Piri bəy Qacardan ibarət olan bu qrupu tədqiqatçılar “Səfəvi hərəkatının nüvə mərkəzi” deyə səciyyələndirir və həmin illərdə hərəkatın uğurla sona çatdırılmasında bu qrupun xüsusi rolunu qeyd edirlər (bax: *R.Savory. Some Reflections on Totalitarian Tendencies in the Safavid State // Der Islam, band 53, Berlin, 1976, p.234*).

[1504] Ərcüvan – indiki Astara rayonunun Ərçivan kəndi. Astara şəhərindən 10 km. şimal-şərqdə, Xəzər dənizindən 4 km. aralı, Ərçivan çayının sahilində, Lənkəran ovalığında yerləşir *(ASE, c. IV, s.229).*

[1505] Deyləman yaylağı – Gilanın Rəşt şəhərindən cənub-qərbdə yerləşir.

[1506] Ə.Nəvai *(Şərhlər, s.935)* bunun “Bərəndüq” kəndi ola biləcəyini ehtimal edir.

[1507] İndiki Güzaz kəndi *(Nəvai, şərhlər, s.935).*

[1508] Küvəri (və ya Kuri, Kəvəri) – bugünkü Kərin və Kəhurəti adlı yerlərlə eyniləşdirilir *(Nəvai, şərhlər, s.935).*

[1509] Məclis nüsxəsi: “Məsabad”. Bu adı Səfiabad və ya Sisabad kimi də mənalandırmaq olar *(Nəvai, şərhlər, 935).*

[1510] Ərdəbilin indiki Arvamıq kəndi ilə eyniləşdirilir *(Nəvai, şərhlər, s.936).*

etmək şərəfinə nail oldu. Əlvənd bəy tərəfindən Ərdəbil və Muğanat hakimi olan Sultanəli bəy Cagirlü o həzrətin yanına adam göndərib [dedi] ki, Ərdəbildə qalmasın, ya da döyüşə və vuruşa hazır olsun. Ertəsi gün [İsmayıl] Ərdəbildən köç edib Mərəni[1511] kəndinə gəldi. Ondan sonra Mirzə Məhəmməd Talışın yanına adam göndərdi ki, zati-alilərinə və əzəmətli qazilərə qışlaq üçün bir yer ayırsın.

İsgəndər şanlı xaqanın əhvalının necəliyindən agah olan kimi Mirzə Məhəmməd ulu dərgaha tələsərək ali əşrəfə ərz etdi ki, ürəyinizin səhifələrində əks olunduğu şəkildə istirahət ləvazimatı hazırlanacaqdır. Ona görə də İsgəndər şanlı xaqan Ərcüvanda qışlaq etdi və Mirzə Məhəmməd ali əşrəfin könlünü razı salmaq və dövlət böyüklərinə xidmətkarlıq göstərmək üçün elə çalışdı ki, iki dilli qələm onları sadalamaqla qurtara bilməz. Ali məqamlı xaqan əksər vaxtını balıq ovlamaqla keçirirdi. O əsnada Sultanəli bəy Cagirlü, Mirzə Məhəmmədin anasının yanına adam göndərdi və ona sonsuz vədlər verərək xahiş etdi ki, İsgəndər şanlı xaqan dəniz kənarında balıq tutmaqla məşğul olan zaman onu bacardığı tərzdə dənizə atsın. Mirzə Məhəmmədin iş icraçısı olan Həmzə Talış, Mirzə Məhəmmədin anası və Sultanəli bəy Cagirlü ilə müttəfiq olub fürsət gözləməkdə idilər. Əvvəlcə Mirzə Məhəmmədin bu işdən xəbəri yox idi. Amma anasının hərəkət və davranışlarından bu niyyəti anladı. Anasını danladı və ona [bu işdən] çəkinməyi buyurdu. Həmzə Talışı da çox təhqir edib azarladı və həmişə bu işin gizli qalmasına çalışdı. Əmirə Ağa Gilani bu hadisədən xəbərdar olmuşdu. Bir gün o, bu əhvalatı Lələ bəylə Xadim bəyə dedi və onlar da kama çatmış əlahəzrətə (İsmayıla) yetirdilər. Bu hadisənin ali əşrəfə məruzə edildiyini öyrənən Mirzə Məhəmməd aləmin pənahı olan dərgaha tələsib İsgəndər şanlı xaqanın hüzurunda and içdi ki, mənim bu niyyətdən qətiyyən xəbərim olmayıb və xəbər tutan kimi anama mane olmuşam və onu danlamışam. Mirzə Məhəmmədin andının məzmunu həqiqətə uyğun gəldiyi üçün onun qəbulu ali əşrəfin dünyanı göstərən rəyinə və qüdrətli dövlət ərkanının könlünə şəfəq saçdı (onun andı qəbul edildi).

Beyt

“Hər hansı söz ki, gerçəkliyə və doğruluğa uyğun gələr,
Onun həqiqəti hər kəsin yanında aydın olar”.

Bəziləri bu hekayəni belə nəql edirlər ki, o zaman Əhmədi bəyin qardaşı Məhəmməd bəy, Mirzə Məhəmməd bəyin mülazimi idi. Əlvənd bəy, Mirzə Məhəmmədlə Məhəmməd bəyin yanına bir adam göndərib onlara Ərdəbil və Xalxal əyalətini vəd etdi. Şərti bu idi ki, İsgəndər şanlı xaqanı tutub onun yanına göndərsinlər. Mirzə Məhəmməd bu məsələ barədə çox götür-qoy etdi və fikirləşdi. Məhəmməd bəy ona dedi:

- Fani dünya hakimiyyəti uğrunda özünü belə bir pis işə bulaşdırmaq, talışın[1512] qeyrətinə yaraşmaz.

Şeir

“Hər kim işlərdə pis düşünsə,
Yaxşılığın üzünü harada görə bilər?!
Hər kim zərər budağını əksə,
Mənfəət meyvəsini haradan yığar?!”

Mirzə Məhəmməd onun sözü ilə bu işi görməkdən daşındı. Məhəmməd bəy bu xəbəri xəlvətcə İsgəndər şanlı xaqana çatdırdı. O həzrət bu səbəbdən xoşhal oldu ki, əgər [bu məsələdən] xəbərsiz qalsaydı, tamam qüsurun baş verməsi mümkün olardı.

Ondan sonra Şirvan padşahı Fərrux Yəsar, Mirzə Məhəmmədin yanına adam yolladı ki, İsgəndər şanlı xaqanı qardaşları ilə birlikdə mənim yanıma göndərməyin üçün sənə min tümən nağd [pul] göndərirəm. Bu xəbər ali məqamlı xaqana çatdıqda, bu üzdən ehtiyatlılıq yolunun yolçusu oldu (ehtiyatlı davranmağa başladı). O əsnada izzət və calal sahibinin (İsmayılın) qulağına çatdı ki, Mirzə Məhəmməd fələyə bənzər dərgaha gəlməkdədir. Qüdrətli dövlətin Hüseyn bəy Lələ, Abdal bəy Dədə, Xadim bəy və Bayram bəy Qaramanlu kimi əmirləri belə məsləhət bildilər ki, Mirzə Məhəmməd müzəffər düşərgəyə çatdığı vaxt nicat tap-

[1511] Mərəni – Ərdəbil vilayətinin Sərdabə bölgəsində kənd.

[1512] Səfəvi ordusundakı talış tayfasının indiki talışlardan fərqli olaraq, türk-moğol mənşəli olması haqqında ehtimal vardır (bax: *Sazmani-idariyi-hokuməti-Səfəvi ya təliqati-Minorski bər “Təzkirətül-müluk”, tərcümeyi: M.Rəcəbniya. Tehran, 1368, s.27; B.Javanshir. İran'daki Türk boyları ve boy mensubu kişiler (Safevî dönemi – I Şah Tahmasp hâkimiyetinin sonuna kadar / 1576). Yayınlanmamış doktora tezi. İstanbul: Mimar Sinan Güzel Sanatlar Üniversitesi, 2007, s.589-590*).

mış sufi firqəsi ("firqeyi-naciyyeyi-sufiyyə")[1513] silahlarını paltarlarının altında gizlətsinlər və əgər Mirzə Məhəmmədlə adamları düşməncəsinə davransalar, onlar da talışların üstünə tökülüb rəqibləri məhv etsinlər. Mələklərin təvaf etdikləri dərgaha ziyarət arzusu ilə gəlmiş bəzi Rum və Şam sufiləri silahlandılar və hazır vəziyyətdə dayandılar. Elə ki Mirzə Məhəmməd çoxlu adamla birlikdə zəfər şüarlı əsgərlərin yaxınlığına çatdı, İsgəndər şanlı xaqan Xadim bəyi, Lələ bəyi və Dədə bəyi onu qarşılamağa göndərdi ki, onun əhvalını öyrənsinlər və onun ürəyinin içindəki sikkələri imtahanın məhək[1514] daşına vurub bu yoxlamanın nəticəsi haqqında rəylərini ərzin zirvəsizə (İsmayıla) çatdırsınlar.

Mirzə Məhəmməd qüdrətli dövlətin ərkanını uzaqdan görüncə, xilaf atından piyada olub onlarla əl-ələ görüşdü və yenidən öz səmimiyyət və sədaqətinin səhifələrini şahın dövlət ərkanının mütaliəsi üçün çevirməyə başlayıb sadiq və fədakar olduğunu iddia etdi. Dərgah əmirləri hadisəni olduğu kimi ali mövqeli xaqana ərz etdilər. Ondan sonra böyük əmirlər onu fələk məqamlı xaqana səcdə etməyə apardılar. Mirzə Məhəmməd bu səadətin şərəfinə nail olduqdan sonra şirvanşahın məktubunu çıxarıb əşrəfin nəzərinə çatdırdı və onun nə xahiş etdiyini dilə gətirdi. [Mirzə Məhəmməd] behişt ayinli məclisdə "Qurani-Məcid" istəyərək, yenidən and içib dedi:

- Mənim fikrimdə bəndəlikdən və fədakarlıqdan başqa heç nə yoxdur. Bu şayiələr mənim sədaqətimin binasına heç bir xələl gətirməyib. Bu işin ali əşrəfin ərzinə çatdığını və mənim barəmdə xəyanət və vəfasızlıq gümanına düşdüyünü bildiyim üçün o təlaşı aradan qaldırmaq məqsədi ilə özümü hörmətli dərgaha yetirdim. Ümidvaram ki, mənim səmimiyyət və fədakarlığımın sikkələri dəfələrlə imtahan məhəkinə vurulub xalis və tam əyarlı çıxdığı üçün daha mənim barəmdə bu cür söz-söhbətləri qəbul etməzlər.

Beyt

"Xeyirxahlar haqqında pislik gümanı,
Rəva deyil, əl çək bu bədgümanlıqdan".

Aləmin pənahı olan şah, Mirzə Məhəmmədi qiymətli xələtlə şərəfləndirdi, onun adamlarına bir-bir layiqli hədiyyələr bağışladı və onları bol-bol şahanə lütflərin və sonsuz padşahanə bəxşişlərin vədləri ilə müjdələdi. Həmin gün [Mirzə Məhəmməd] səadətli məiyyətlə birlikdə qaldı. Ertəsi gün isə o, ayrılmaq icazəsi alıb Bişə-kənar tərəfə qayıtdı. Aləmin pənahı olan şah da hazır saxladığı sufilərə rüxsət verdi ki, öz gəldikləri yerlərə geri dönsünlər.

Həmin il Novruz bayramından ("Novruzi-Sultani") sonra cahan gülzarın bəzənməsi ilə cənnət bağına bənzər olduqda, yer üzünün ətrafı parlaq bitkilər üzündən göy qübbəsi kimi ulduzlarla dolduqda, bahar fərraşı torpağın səthinə rəngarəng xalılarla yaraşıq verdikdə və yaradıcı bağban çəməni cürbəcür güllərlə bəzədikdə, [havada] bir soyuqluq baş qaldırdı. Soyuğun qəhrəmanı, fələk iqlimlərinin sultanının (günəşin) təbiətə müdaxilə etməsinə mane oldu. Fələk iqlimlərinin sultanının fərraşı qulamlıq vəzifəsini yerinə yetirərək calal çadırlarını atəş kürəsində yerləşdirdi. Bitkilər soyuqluq qoşununun qarətinin qorxusundan qarın altında gizləndilər.

Nəzm

"Lalənin rüxsarı qırışla doldu,
Suyun aynası dəmirə döndü (dondu).
Hər yarpaq ki, arsızca cilvələnirdi,
Tökülməyə başladı budağın üstündən".

Qışın qulduru bağ və bostan ağaclarını məhşər gününün asiləri kimi lüt-üryan etsə də, amma dey və bəhmən[1515] hökmdarı onların hamısına samur dərisi (qar nəzərdə tutulur – tərcüməçilər) bağışladı və qarın çoxluğundan dağların zirvələri nəzərə çöl və səhra ilə eyni göründü. Yer beşiyində bir neçə bitki tifilinə malik çəmənin nərgizdən başqa övladı qalmadı və hamısı xəstə gül kimi soldular, lalə şamı kimi söndülər.

---

[1513] Baroda nəşri: "taclı sufi firqəsi" ("firqeyi-taciyyeyi-sufiyyə"). Şah Xətainin "Naci derlər bir güruha uğradım" misrası ilə başlayan qoşmasında bu firqə hörmətlə xatırlanmaqdadır *(Şah İsmail Hatai külliyatı. Hazırlayanlar: B.Cavanşir, E.N.Necef. İstanbul, 2006, s.478-479).*

[1514] Məhək – bir neçə mənası var: 1) gümüş və ya qızılın əyarını yoxlamaq üçün xüsusi daş; 2) bir şeyin cinsini və növünü göstərən meyar (məcazi anlamda); 3) həyatın sınağı, həyat təcrübəsi (məcazi anlamda). Burada həm sikkə, həm də məhək sözü məcazi mənada istifadə edilmişdir.

[1515] Dey və bəhmən – İran günəş təqviminə görə, qış fəslinin birinci və ikinci aylarıdır.

Şeir

“Ölməkdən başqa yox idi atəşin təmənnası,
Çünki həyatda soyuğa tabı yox idi.
O can alan vadinin içində qardan,
Yer ilə göy birləşmişdi bir-birinə.
Dəmirin soyuqluğundan qığılcım qaçmışdı,
Uşaqlar kimi məktəbdən tez çıxıb getmişdi.
Şəfəqə sarı dikilmişdi gözlər,
Onun rəngi atəşdən nişan verdiyi üçün”.

Səmada uçan quşlar soyuqdan qar üstünə düşüb, qaçmağa və uçmağa macal tapmırdılar və insanlar o quşların hər cürəsindən tutub ali əşrəfin nəzərləri qarşısına gətirirdilər. İsgəndər şanlı xaqan o haldan təəccüb etmişdi. Çünki heç zaman bu cür şiddətli soyuq olmamışdı. Ondan sonra o həzrət buyurdu ki, qalibiyyətli əsgərlər və xanədanın müridləri qardan qala tərtib etsinlər. Qazilər elə bir qala düzəltdilər ki, hündürlükdə fələklər fələyi ilə bərabərlik iddiasında idi və onun üç tərəfindən qapı açdılar. İsgəndər şanlı xaqan qalanın aşağısında idi. O, bir dəstəyə əmr etdi ki, qalanın içində olsunlar və digər bir dəstəyə də buyurdu ki, iki tərəfdən [qalaya] hücum etsinlər. Özü də şəxsən səadətlə başqa bir qapıdan yürüş edib qalanı ələ keçirdi.

Sabit və səyyar göy cisimlərinin (planetlərin və ulduzların) sultanı (günəş) bahar bürcünün əvvəllərində mənzil etdikdən sonra o həzrət hərəkət bayrağını Gögçə-dəngiz tərəfə yüksəltdi. Ləngərkonanda (Lənkəranda) Şahsüvar bəyin mənzilində dayanıb bir gecə orada qaldı və ertəsi gün köç edib, Manian kəndinə[1516] gələrək Muğanat hakimi Nuşir bəy Talışın evində cal-calalla dayandı. Oradan müqəddəs və nurlu məqbərəyə yollandı və Sultan Heydərin evlərində cah-calalla dayandı. Oradan da Gəncəyə tərəf tələsdi.

Yol əsnasında məlum oldu ki, Mirzə Cahanşahın övladlarından Sultan Hüseyn Barani adlı birisi bir dəstə fitnəkar adamla Gögçə-dəngiz (Göyçə gölü) hüdudunda oturub öz beyninin sarayına xəyal buxarının girməsinə yol vermiş və o diyarın ətrafını çalıb-çaparaq bir dəstəni özünə müttəfiq etmişdir[1517]. Amma o, bu mənadan xəbərsiz idi ki, qarışqanın əlindən alınan çəyirtkə ayağından Süleyman süfrəsi düzəlməz, yoxsuldan qarət edilmiş qədəhdən Davudi zireh əmələ gəlməz və möhtacdan tarac olunan mələfədən (yorğan-döşək üzündən) padşahlara paltar hazırlanmaz. O, bu beytlərin məzmunundan qafil idi:

Şeir

“İzzət və cah-calal tacını qeysərdən al,
Yun papaqlı dərvişin başından deyil.
Cəmşidin əlindən al qızıl camı,
Dilənçinin əlindən kəşkülü deyil.
Qartalın qanadından al sivri lələyi,
Toyuq qanadı ox üçün yararlı deyil.
Möhkəm nizəni meşə ağacından düzəltmək olar,
Qara bəxtli katibin qələmindən deyil.
Bacarırsansa, aslanın dərisini üz,
Qoyun dərisindən hər kəs paltar geyə bilər” [1518].

İsgəndər şanlı xaqan onun dəf və məhv edilməsi barədə qüdrətli dövlət ərkanı ilə məşvərət etdi. O əsnada sözügedən şəxsin tərəfindən ulu dərgaha qasid gəlib bir məktub gətirdi. [Məktubun] məzmunu belə idi:

“Əgər Allahın kölgəsi olan şahın dövlətinin səadətli hümay quşu müxlislərin başına uğur kölgəsini salarsa, itaət və tabeçilik yəhərini çiynimizə salarıq, cah-calal bayraqları hər hansı tərəfə hərəkət etsələr, kölgə kimi onları müşayiət edərik, xidmətkarlığın şərtləri, sadiqliyin və fədakarlığın zərurəti nədirsə, ona əməl edərik. Müzəffər cənabınıza olan sədaqət və etiqadın məstliyi bu acizin (məktubun müəllifinin) damarlarında elə bir keyfiyyətlə axmaqdadır ki, digərlərinin naxışını ürək lövhəsindən yuyub aparmışdır və sevgi ilə bağlı-

---

[1516] Baroda nəşri: “Matian kəndinə”; Bakı nüsxəsi: “Mabtan qalasına”.
[1517] Məclis nüsxəsi: “öz ətrafına toplamışdır”.
[1518] Son beyt Tehran çapında yoxdur, Baroda nəşri və Bakı nüsxəsi əsasında tərcümə edilmişdir.

lıq cazibəsi könül məcralarında elə bir heysiyyətlə yayılmaqdadır ki, yaxınlıq birliyə çevrilmişdir. Hər halda, belə bir söhbət dəyişkənlik xələlindən xali və dəyişiklik əməlindən uzaq olacaqdır

Beyt

Könlüm quşu ixlasa elə muğayat olub ki,
Heç bir digər səmtə pərvaz eyləməz".

İsgəndər şanlı xaqan bildi ki, onun yaltaqlanmaları sünidir və izhar etdiyi hüsn-rəğbət yalana bulaşmışdır. [Ona görə də] həmin sözlərə əhəmiyyət vermədi. Çünki zəmanə oğulları hər cür məhəbbət və səmimiyyətdən dəm vursalar da, hər növ sədaqətdən danışsalar da, onların əhvalı dəqiq nəzərlə yoxlanıldıqda məlum olur ki, mövcudluq (gerçəklik) mənzilindən yüz mərhələ uzaqda və sadiqlik yolundan yüz mərhələ kənardadırlar.

Beyt

"Vəfa axtarma dövrandan, çünki heç kəs,
Heç bir zaman dünya gülzarından vəfa qoxusu almadı".

Ondan sonra o həzrət bir neçə gün Gögçə-dəngizdə qaldı. Sultan Hüseyn Barani Tanrının kölgəsinin (İsmayılın) [orada] qalmasından xəbərdar oldu. Məkr və yalan tacını başına qoydu, fırıldaqçılıq əbasını geyindi, xəyanət və hiylə atını altına alıb çaparaq ulu dərgaha tələsdi. Birlik (ittihad) qaydaları ilə sözə başladıqdan sonra o həzrətin qulağına [bunları] çatdırdı:

- Əgər İsgəndər şanlı xaqan ona tərəfdar olanların (müxlislərin) fəqir komasını öz hüzurunun nuru ilə şərəfləndirərsə, hər halda, bu şərəfdən Qaraqoyunlu tayfasının fəxr və iftixar tacı göy üzünün zirvəsinə çatacaqdır və irsi kin-küdurət səfa ilə əvəzlənəcək, aralıqdakı səmimi münasibət elə möhkəmlənəcək ki, zaman hadisələrinin ucbatından sarsıntıya uğramayacaqdır.

İsgəndər şanlı xaqan və qüdrətli dövlət ərkanı zamanın tələbini nəzərə alaraq, dəvəti qəbul etməyi lazım bildilər və "Əgər onlar səni aldatmaq istəsələr, [qorxma və bil ki, onların şərindən və məkrindən qorumağa] sənə təkcə Allah kifayətdir"[1519] lütfünə arxalanıb Sultan Hüseyn Baraninin[1520] mənzilinə yollandılar. O əsnada könüllü döyüşçülər dəstə-dəstə ulu dərgaha gəlməkdə idilər. Belə ki, qələbə ayətli bayraqlar Sultan Hüseyn Baraninin ordusuna doğru yola düşən vaxt onları min atlı və piyada müşayiət edirdi. Ali məqamlı şah onların hiyləsindən agah olduğu üçün qərar verdi ki, qələbə nişanlı əsgərlərin çadırları əlahiddə şəkildə qurulsun, Sultan Hüseynin ordusuna qarışmasın və qatışmasın. [İsmayıl] üç gün boyunca [Sultan Hüseynin] ordusunun yaxınlığında qaldı. Bu günlər ərzində Sultan Hüseyn Barani xidmətkarlıq və fədakarlıq mərasimində, ulu dərgaha töhfələr və hədiyyələr göndərməkdə və qüdrətli dövlətin ərkanına qonaqpərvərlik göstərməkdə səhlənkarlığa və diqqətsizliyə yol vermədi. İsgəndər şanlı xaqan onun dostluq buludundan nifaq yağışı damlalarının axdığını və yağdığını bildiyi üçün həmin mənzildən köçməyi lazım gördü və dövlət ərkanı ilə məsləhətləşib hərəkət və köç etməyi qərara aldı. Sultan Hüseyn bu niyyətdən agah olub, ərşə bənzər bargahın əmirlərini, dayaqlarını və əyanlarını çağıraraq, kama çatmış cənabın (İsmayılın) qalması barədə [onlarla] müşavirə etdi.

Əmirlər qalmaq məsələsini ali əşrəfin ərzinin zirvəsinə çatdırmazdan öncə elə cavab verdilər ki, Sultan Hüseyn Barani onların qalmağının mümkün olmayacağını və bu xahişinin qəbul edilməyəcəyini başa düşdü. Əmirlər xilafət təyinatlı taxtın ətəyinə getdikdən sonra Sultan Hüseyn fikrindən keçirdi ki, bacardığı tərzdə İsgəndər şanlı xaqanı və dövlət ərkanını dustaq və əsir edib zəncirə vursun. Amma o, bu mənadan xəbərsiz idi ki, sübh çağı günəşin doğmasını kiçik bir bulud parçası gecikdirə bilməz, müşk saçan mehlərin gözəl qoxusunu əyyamın hoqqabazı səba yeli ilə aradan apara bilməz, hörümçək torundan düzəldilmiş kəməndlə qızmış aslanı bağlamaq olmaz və oğlan uşaqlarının oynamaq üçün düzəltdikləri taxta qılıncla cüssəli fili yıxmaq olmaz. Sultan Hüseyn Barani qeyri-mümkün bir xəyalla və batil düşüncə ilə bir söhbət məclisi təşkil etdi və ulu dərgahın müqərrəblərindən (yaxınlarından) xahiş etdi ki, onun zülmətli mənzilini İsgəndər şanlı xaqanın hüzurunun nuru ilə "möminlərə vəd edilən cənnəti"[1521] qısqandıracaq şəkildə rövnəqləndirsinlər (İsmayılı götürüb onun evinə gəlsinlər). Əmirlər onun məkr və hiyləsini məlum etdiklərinə görə yalandan bəha-

---

[1519] *Qurani-Kərim, "Ənfal" surəsi, 62-ci ayə.*
[1520] Ağqoyunluların digər bir adı Bayandur olduğu kimi, Qaraqoyunluların da digər bir adı Barani idi *(Nəvai, şərhlər, s.943).*
[1521] *Qurani-Kərim, "Rad" surəsi, 35-ci ayə.*

nə gətirdilər ki, İsgəndər şanlı xaqan xəstələnmişdir. Hüseyn bəy Laləni ali məqamlı şahın xidmətində qoydular. Dövlət ərkanının qalanları ziyafətdə iştrak etmək üçün Sultan Hüseyn Baraninin mənzilinə getdilər və üzrxahlıq etdilər ki, İsgəndər şanlı xaqanın səhhəti pozulmuşdur və zati-alilərinizlə söhbətə gəlməyi müyəssər olmamışdır. Sultan Hüseyn bunu doğru hesab edib həmin gün eyş-işrət bayrağını yüksəltdi, ziyafət və qonaqpərvərlik mərasimində heç bir nöqsana yol vermədi. Elə ki gün axıra çatdı, böyük əmirlər rüxsət aldılar və xaqanın[1522] hüzuruna tələsdilər. İsgəndər şanlı xaqan qərara aldı ki, Sultan Hüseyndən rüxsət almadan o mənzildən köç etsinlər və Çuxursəədə yollansınlar.

Zülmət gecə özünün qaranlıq pərdəsi ilə günəşin üzünü örtdüyü, fələyin sütunsuz çadırında planetlərin və ulduzların məşəlləri yandığı və yuxu sultanı insanların başlarındakı hissləri ətalət halına saldığı zaman ali məqamlı şah əmr buyurdu ki, qalibiyyətli qazilərin hər biri çadırları çoxlu şam və məşəllər yandırmaqla firuzə rəngli səmaya bənzətsinlər, qazanları doldurub assınlar və qazanların altında atəş yandırsınlar ki, uzaqdan baxan adamlar zəfər nişanlı ordunun düşərgəsində yemək bişirildiyini zənn etsinlər. Ondan sonra dağ görkəmli dəvələri və ildırım sürətli qatırları yükləyib yola düşdülər. Sultan Hüseyn Barani və onun adamları bu hərəkətdən və köçdən xəbərsiz qalıb şamlardan, məşəllərdən və ocaqların yanmasından belə nəticə çıxardılar ki, onlar öz yerlərində qərar tutmuş və hərəkət etməmişlər.

Ertəsi gün ulduzların şamları və məşəlləri günəşin nurunun şəfəqi ilə sönüb yox olduqda Sultan Hüseyn, İsgəndər şanlı xaqanın hərəkətindən agah oldu. Onun qəzəb atəşi alovlandı. O, ali məqamlı şahın arxasınca sürətlə yürüş edib zəfər nişanlı ordugahın yaxınlığına çatdı. İsgəndər şanlı xaqan düşmənlərin çoxluğundan əndişə etməyib mətin ayağını meydanda möhkəmlətdi. Düşmənlərin ürəyinə xof düşdü və onlar geri çəkildilər. Ondan sonra İsgəndər şanlı xaqan Çuxursəədə çatdı və o mənzildən də köç edib Doqquz-Üləmdə dayandı.

### Qaraca İlyasın və Rum sufilərinin gəlməsi haqqında söhbət[1523]

Aləmi işıqlandıran şahlıq günəşi İlahi əmrlə sonsuz lütf mənbəyindən doğub, [dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin ətrafında və yan-yörəsində işıldadıqda və parladıqda imamət xanədanına münasibətdə səmimiyyət və etiqaddan dəm vuran hər kəs başını ayağa çevirib (canla-başla yola çıxıb) zəfər nişanlı əsgərlərin düşərgəsinə tələsdi. O cümlədən Qaraca İlyas Rum sufilərindən [ibarət] bir dəstə ilə ümidlərin Kəbəsi və istəklərin qibləsi olan fələk əsaslı dərgaha [gəlmək üçün] ehram bağlayıb yola qədəm qoydu. Məsafələri qət etdikdən və əziyyətə qatlaşdıqdan sonra onlar Şuregelə[1524] yetişdilər ki, oradan Çuxursəədə yollanıb büsatı öpmək şərəfinə nail olsunlar. Orada Məntəş adlanan fil cüssəli bahadıra və qoşun qıran sərkərdəyə məxsus möhkəm bir qala var idi. O, Qaraca İlyasın və sufilərin gəlişindən xəbərdar olub onları qarşıladı və ziyafət təşkil etdi. O, neçə nəfər Rum sufisini öz mənzilinə gətirdi və öz mülazimlərinə əmr etdi ki, onları qarət etsinlər. Sufilər gücləri və imkanları yetdiyi qədər müdafiə olunub çoxlu səylər nəticəsində özlərini o coşqun dənizdən nicat sahilinə çatdırdılar və ulu dərgaha yollanıb əhvalatı ərz etdilər. Bu ədəbsizliyi eşidən [İsmayılın] qiyamət oduna bənzər qəzəb atəşi alovlandı və o, bir dəstə bahadırla Məntəşin qalası üzərinə sürətli yürüş etdi. Rüstəmə oxşayan xaqanın hərəkətindən xəbər tutan Məntəş qalanı öz etimadlı adamlarına tapşırıb fərar vadisinə tələsdi. Düşməni qıran xaqan bir dəstə cəsur döyüşçü ilə o qalanın ətrafına çatdı. Qazilər soyğunçuluq və qarətlə məşğul oldular. Bir dəstə düşmən vuruşmaq əzmi ilə savaş meydanına gəldi. İsgəndər şanlı xaqan onların qətlinə fərman verdi. Dövlət düşmənlərinin bir çoxları zillət torpağına düşdülər. Zəfər qazanmış qoşunlar qeyri-məhdud qənimətlərlə Kağızman (Qaqızman) yolundan Tərcana hərəkət etdilər. Oradan Sarıqaya yaylağına getdilər və orada qaldılar. Orada xəbər gətirdilər ki, bir ayı bir mağarada məskən salıb insanlara əziyyət verir. Aslan ovlayan xaqan o yaramazı dəf etməyə yollandı. Sayı ulduzlar qədər [çox] olan və mələklərdən kömək alan ordu o vəhşinin məskənini pərgar kimi əhatəyə aldı. O zəfər nişanlı

---

[1522] Məclis, Nuruosmaniyyə və Bakı nüsxələri: "şahın".

[1523] Nuruosmaniyyə nüsxəsi: "Qaraca İlyasın fələk əsaslı dərgaha gəlməsi haqqında"; Bakı nüsxəsi: "Qaraca İlyasın İsgəndər şanlı xaqanın fələk əsaslı dərgahına gəlməsi haqqında"..

[1524] Şuregel (Şüregel, Şuragil) – indiki Türkiyə - Ermənistan sərhədində, Qars-Arpaçayı boyunda yerləşən və Gümrü şəhəri zonası ilə Qars vilayətinin Arpaçay ilçəsinin Qızılçaqçaq və Başgediklər bölgələrini içinə alan tarixi mahal *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi. Ankara, 1993, s.102).*

qoşunun avazından ayı mağaradan bayıra atıldı. Aslan ürəkli xaqan on üç yaşında olmasına baxmayaraq, o yırtıcını öldürmək üçün irəli gedib, Böyük Ayı bürcünə bənzəyən o qorxunc vəhşini bir oxla yerə sərdi və öz şərəfli mənzilinə təşrif gətirdi. İki ay ərzində orada qaldıqdan sonra Ərzincana hərəkət etdi.

### Xorasan vilayətində baş vermiş hadisələr haqqında söhbət

Sultan Hüseyn mirzə Astarabadda olduğu vaxt Bədiüzzaman mirzə Sistandan və Əmir Zünnun Ərğun Zəmindavərdən bəla əlamətli ordu ilə Herat vilayətinə tələsdilər və padşahın dövlət ərkanının mal-qarasından və örüşlərindən hər nə tapdılarsa, ələ keçirdilər. Bu xəbərin yayılması ilə Əmir Əlişir, Məhəmməd Vəli bəy və b. əmirlər iztiraba qapıldılar. Bədiüzzaman mirzə Evbehə çatdıqda Əmir Zünnun qabaqda hərəkət etməyə başladı. Bölükat camaatı onu tənha gördükdə elə təsəvvür etdilər ki, Bədiüzzaman mirzə çıxıb getmişdir və Əmir Zünnun təkbaşına ərğun [tayfasının] qoşunu ilə Heratı mühasirəyə almağı xəyal edir. Onlar şəhərə gəlib dedilər:

- Əmir Zünnun az qoşunla yaxınlığa çatmışdır və əgər əmirlər döyüşmək üçün [şəhərdən] çıxsalar, böyük ehtimalla onu dustaq edərlər.

Elə həmin vaxt Məhəmməd Məsum mirzə Çiçəktu tərəfdən Herata yetişdi. Əmir Məhəmməd Vəli bəy bundan xəbər tutub, yaxşı silahlanmış üç min süvaridən ibarət dəstə ilə ali dərəcəli şahzadənin üzəngisinin həndəvərində şəhərdən çıxdı. O, mərkəzdə Məhəmməd Məsum mirzəni saxladı, özü sağ cinahda dayandı və sol cinahı tutmağı Seyid Abdulla mirzə ilə Əmir Baba Əlinin öhdəsinə qoydu.

O tərəfdən isə Bədiüzzaman mirzə bir dəstə igidlə Ləkləkxana ətrafında Əmir Zünnuna qoşuldu. Yemək süfrəsi qoyulan zaman zəfər nişanlı qoşunun qaravulları xəbər gətirdilər ki, yağı (düşmən) görünmüşdür. Əmir Zünnun ərğun [tayfasının] qoşunu ilə üzəngiyə ayaq basıb onların qarşısına çıxdı. Üləngi-Neşin nahiyəsində qəzəb və kinlə dolu o iki qoşun bir-birinə çatdılar. Cəsur kişilərin kininin sərsəri küləyindən müharibə atəşi alışdı. Qırğın alovlarından savaşçı igidlərin həyat xırmanı yanmağa başladı. O əsnada Bədiüzzaman mirzə hərb meydanına çatdı. Herat camaatı o halı müşahidə etdikdə əlləri işdən üzüldü. Əvvəlcə Seyid Abdulla mirzə və Əmir Baba Əli fərar etdilər. Ondan sonra Məhəmməd Məsum mirzə və Əmir Məhəmməd Vəli bəy də qaçmağı vuruşmaqdan üstün bildilər. Məhəmməd Məsum mirzə və Seyid Abdulla mirzə hökmdarın ordusuna üz tutdular. Əmir Məhəmməd Vəli bəy isə şəhərə daxil olub darvazaları bağladı. Bədiüzzaman mirzə şəhəri əhatəyə aldı. Ümid edirdi ki, əhali şəhəri ona döyüşsüz təslim edəcəkdir və [bu səbəbdən] ordusuna savaşa başlamaq icazəsi vermədi. Qırx gündən sonra Sultan Hüseyn mirzənin qayıdışı xəbəri ağızdan-ağıza dolaşdı. Əmir Əlişir, Bədiüzzaman mirzənin yanına adam göndərib onu atası ilə savaşmaqdan çəkindirdi (qorxutdu). Ona görə də Bədiüzzaman mirzə Malan körpüsündən[1525] Mürğab tərəfə tələsdi. Dörd gündən sonra Sultan Hüseyn mirzə Herata çatdı.

### Rum vilayətindəki hadisələr haqqında söhbət

Bu il Rum padşahı Sultan Bayəzid fələyin hadisələrindən və səhradakı qumdan daha çox olan ordu ilə bədbəxt kafirlərin diyarına hərəkət etdi. Hərb alətlərini tərtib etmək üçün top və tüfəng cəmləşdirdilər və hər dənizdən çoxlu gəmi toplayıb həmin gəmilərə toplar və zərbzənlər yerləşdirdilər. O cümlədən iki gəmi vardı ki, Firəng və Rumeli dənizçilərinin istilahında ona "gugə" (və ya "kukə") deyirlər. Elə bir gəmini düzəltdirmək hökmdarlardan başqa kimsəyə müyəssər ola bilməz. Çünki onların hər birinin xərci iyirmi dörd min əşrəfidir. Gəmilər adlarına və siniflərinə görə bu şəkildə bölünür: "gugə", "mavna", "barça", "qadırqa", "qalyon", "dərəcə". "Qadırqa" adlanan [gəmi] növünün yelkəni yoxdur. O, avarlarla hərəkət edir. Amma bütün gəmi növlərindən daha sürətlidir[1526].

---

[1525] Malan körpüsü (Püli-Malan) – Hərirud çayı üzərində, Heratdan təxminən 12 mil cənubda yerləşən tarixi körpü *(Seddon, şərhlər, s.221).*

[1526] Mavna (ərəbcə "məunə") – böyük və üçkünc yelkənli yük gəmisi idi. Bundan başqa, mavna hərbi məqsədlər üçün də istifadə edilirdi. Onun hərbi növü qadırqadan daha ağır və möhkəm olurdu. Barca (barça) – əsli italyancadır (barza). Yelkənli və avarlı kiçik hərb gəmisidir. Çəkisi yüz tondan azdır. Qadırqa (kadırqa) – əsli yunancadır. Avropalılar bu gəmini "qalera" adlandırırlar. Bu tip gəmidə üç sıra avarçəkən otururdu. Həsən bəy Rumlu onun yalnız avarla hərəkət etdirildiyini yazsa da, tarixdən bəllidir ki, yelkənlə hərəkət edən qalera (qadırqa) növləri də vardı. Qalyon (kalyon) – əsli italyancadır (galeone). Yelkən və avarla hərəkət edən hərb gəmilərinin ən böyüyü idi. Böyük coğrafi kəşflər zamanı ispanlar onu uzaq yollar üçün düzəltmişdilər. Lakin daha əvvəl bircə sıra avar-

Nəzm

“Çeviklikdə iti qaçan bir atdır, səba küləyindən daha cəlddir,
Taxtadan bir minik vasitəsidir, təxti-rəvandan yüz yol daha yaxşıdır”.

“Gugə” adı ilə tanınan [gəmi] oxla kamanın əksinə, oxun ortasında kaman kimidir. Həmişə onun kamanı ox kimi rəvandır və onun oxu kaman kimi həmişə sabitdir.

Nəzm

“Bu göy qübbəsinin altı yetərincə qorxunc olduğundan,
Özünü qorumaq üçün kamanında ox saxlayır”.

Mavna deyilən növ geniş və açıq bir qala kimidir.

Nəzm

“Əjdaha kimi böyük balıq, balıq kimi gedən əjdaha,
Tərsinə dönmüş tısbağa, civə yuvalı simurq.
Cəsarətdə timsah kimi, amma ondan daha qorxunc,
Döyüşə meyil edən qəhrəman, sahibqiran sərvər.
Müşkülü həll olmayınca könül xoşluğunun mehi ilə,
Onun qarşısında asan olmaz qət etmək ucsuz-bucaqsız dənizi.
Novdan şəkillidir və sənət ustadları bağlamışlar,
Öz hünərlərini göstərmək üçün yüz evi bir novdana”.

“Qalyon” adlanan növ mavna şəklindədir. Amma kiçikdir. “Dərəcə” isə gəmi siniflərinin ən kiçiyidir və sürətlidir.

Nəzm

“Yeyin bir atdır ki, ayaqsız və yorğa,
Küləyin su üzərində yaratdığı dalğalar kimi.
Dağ hörgüclü və dikbaş dəvə kimi,
Sərməstlikdən çoşan və köpük atan”.

Sultan Bayəzid şəvval [ayının] 8-də (07.05.1500) çoxlu ordu ilə məqsədə doğru hərəkətə başladı. Gelibolu hakimi Davud paşa dəniz sərkərdələri ilə, Bəhram [kimi] qəhredici qoşunlarla, səyahət şüarlı gəmiçilərlə, dənizdə üzənlərin ümdələri və bacarıqlı dənizçilərin öndə gedənləri olan Rəis Kamal və Rəis Büraqla “gugə” deyilən iki gəmiyə mindilər. Üç yüz digər gəmi və Rum cavanları çoxlu tüfəng və zərbzənlə Gelibolu keçidinə doğru yola çıxdılar ki, oradan Mora adasına hərəkət etsinlər, Mora kənarından İnəbəxti ətrafına gəlsinlər və Sultan Bayəzid də quru yolla qalanı əhatə etsin. Onlar yelkənlərini açıb yola düşdülər.

Nəzm

“Elə ki yelkənlə külək yoldaş oldu,
Tələsən [gəmi] quşlarla sirdaş oldu.
Bu minvalla günəşin batmağına qədər,
Gəmi sürətlə yola davam etdi”.

Elə ki Mora adasına çatdılar, o tərəfdən İnəbəxtinin sahibi olan Venedik valisi agah oldu. O da böyük bir qoşunla, çoxlu gəmi ilə, hədsiz və saysız top-tüfənglə döyüşə və vuruşa yollandı. O əsnada külək arzunun ziddinə, bəlkə də, pis xilqətli kafirlərin istəyinə uyğun şəkildə əsməyə başladı. Rumilər öz gəmilərini möhkəm bir yerə çəkib təqribən iyirmi gün gözlədilər. Bu hadisənin xəbərini sultana göndərdilər. Ona görə də Sultan Bayəzid xan, vəzir Əhməd paşa Hersekoğlunu bir dəstə zəfər şüarlı bahadırla kafirlər qövmünü dəf etməyə yolladı və arzulanan külək əsməyə başladı. Firəng qoşunları qalaya bənzəyən, hər birində min adam olan, hamısı hərb alətlərinə malik, hərəsində yeddi firəngi və iyirmi qazqan olan, hər bir topu beş batmandan əlli batmanadək daş (mərmi) atan yüz əlli gəmi ilə Rum ordusunun qarşısına çıxdılar və müşrikliyin başı aşağı çevrilmiş bayraqlarını, kafirliyin tərsinə dönmüş ələmlərini yüksəltdilər. Bu tərəfdən isə Rəis Kamal və Rəis Büraq nifaq əhli üzərinə yeriyib top, tüfəng və zərbzən atmağa başladılar. Tüfəng və zərbzən sədasından ulduz asimanda yolunu azdı. Kosun gurultusu, ney və zəng sədası Əyyuqa yetişdi.

---

çəkənə malik kiçik gəmilərə “qalyon” deyilirdi *(Türkçe sözlük. Hazırlayanlar: Hasan Eren vd. Ankara, 1988, I c., s.142, II c., s.756,773,996; Nəvai, şərhlər, s.947-948).*

Savaş əsnasında Firəng ordusundan içində iki min adam olan iki ədəd dağ kimi gugə, bir mavna və içində beş yüz nəfər bədbəxt olan bir barca Rum ordusuna üz qoydu. Onlar Rəis Büraqın gəmisinə dəmir qarmaqlar atdılar və o iki gəminin arasına ağ neft tökdülər. Hərçənd rumilər cəhd etdilər ki, öz gəmilərini kafirlərin gəmisindən ayırsınlar, bu, [onlara] müyəssər olmadı. Nəticədə, firənglərin iki gəmisi ilə rumilərin gugəsi yandı. Kamal bəy, Qara Həsən, Rəis Büraq və rumilərdən [daha] beş yüz nəfər ölümün zəhər dadan şərbətini içdilər. Suya düşmüş digər yeddi yüz nəfər gəmiyə çıxdılar. Rum ordusu dənizə düşmüş yeddi yüz nəfər firəngi qətlə yetirdi. [Rumilər] firənglərin bir mavnasını və bir barcasını top zərbəsi ilə sındırdılar və min beş yüz firəng ölüm girdabında qərq oldu. Bir firəng qalyonunu zəbun edib təxminən üç yüz əlli nəfəri gedər-gəlməzə göndərdilər. Zəmanə şirk və zəlalət əhli üçün işıqlı gündüzü qara gecəyə çevirdi. Dənizin üzü onların qanından qırmızı söyüd rəngini aldı. Şan-şöhrətini itirmiş firəng ordusu fərar yolunu tutdu. Rumilər İnəbəxtiyə yollandılar. Üç ay sonra azğın kafirlər Rum ordusunun üzərinə gəldilər. Döyüşdən və vuruşdan sonra qaçmağa başladılar. Rumilər qurudan və dənizdən qalanı mühasirəyə aldılar. Qala əhlini böyük bir xof bürüdü. Onlar qalanı təslim etdilər. Sultan Bayəzid xan qalanı öz etibarlı adamlarına tapşırıb Ədirnəyə qayıtdı. O, hökm etdi ki, Sinan paşa və Mustafa paşa [həmin] qalanın yanında daha iki qala tikdirsinlər. İdarəçilik təcrübəsinə malik paşalar qısa müddət ərzində bir-birinin yanında iki möhkəm qala tikdirdilər.

### Xorasanda baş vermiş hadisələr haqqında söhbət

Bu il Məhəmməd Hüseyn mirzə İsfərayinə yollanıb Əmir Bədrəddini qətlə yetirdi. Əmir Bədrəddinin öldürülməsindən xəbər tutan Müzəffər Hüseyn mirzə onunla döyüşmək əzmi ilə Səbzəvara hərəkət etdi. O, Əmir Bərəndüq Barlasın oğlu Əmir Məhəmməd Qasımı zəfər iddiasında olan qoşunun bir dəstəsi ilə mənqəlay qaydasınca irəli göndərdi. Əmir Məhəmməd Qasımla sərdarları Məhəmməd Kukəltaş olan Astarabad qoşununun ön dəstəsi arasında çox gərgin bir vuruşma baş verdi. Məhəmməd Qasım ox zərbəsi ilə yerə sərildi. Məhəmməd Kukəltaş fəth və qələbə qazandı. Qaçanlar Müzəffər Hüseyn mirzəyə çatdıqda, o da fərar edib Zavə[1527] tərəfə tələsdi. Köpək mirzə bu xəbəri eşitdikdən sonra müqəddəs Məşhədi tərk edib fərar etməyi qərara aldı. Məhəmməd Hüseyn mirzə Xorasanı boş görüb Astarabaddan Nişapura qədər [olan əraziləri] zəbt etdi.

### Müxtəlif əhvalatlar

Bu il Sultan Hüseyn mirzə Bəlx hakimliyini ətraf ərazilər və yan-yörəsi ilə birlikdə Mirzə Bədiüzzamana verdi və onun adını xütbədə öz adı ilə yanaşı oxutdurdu.

### Ölümlər

Mövlana Həsənşah[1528] cavanlığının əvvəllərində Mirzə Sultan Məhəmmədin xidmətində idi. O əsnada bir gün hökmdarların eyiblərindən (qüsurlarından) söz düşdü. Mövlana Həsənşah keçmiş sultanların hər birinə bir eyib (qüsur) mənsub etdi. Mirzə Sultan Məhəmməd ondan soruşdu:

- Mənim nə eybim (qüsurum) var?

Mövlana cavab verdi:

- Tənbəllikdən başqa sizdə bir eyib görmürəm.

Padşah söylədi:

- Mənim tənbəl olduğumu haradan bildin?

Dedi:

- Ondan bilirəm ki, sən “Mövlanaya on min dinar verin!” deyə bilərsən, amma demirsən.

Mirzə Sultan Məhəmməd bu sözü eşitdikdə gülməyə başladı və Mövlanaya beş min dinar bağışladı. Mövlana dedi:

---

[1527] Zavə – Həmdulla Qəzviniyə görə, Xorasanda, Tus şəhərindən 19 fərsəx şimal və şimal-qərb istiqamətində yerləşən şəhər *(Seddon, şərhlər, s.221)*.

[1528] Xorasan Teymurilərinin xidmətində olmuş XV əsr şairlərindəndir. Zarafatcıllığı ilə seçilirdi (bax: *Ali-Şir Nevayi. Mecalisün-Nefayis. Hazırlayan: K.Eraslan. Ankara, 2001, I c., s.82-83, II c., s. 400*).

- Budur, tənbəlliyinin çoxluğu ucbatından yarı yolda qaldın.

Mövlana yüz ildən artıq ömür sürmüşdür.

Mövlana Məsud Şirvani kəlam, məntiq və fəlsəfə (“hikəmiyyat”) elmlərində Xorasan alimlərinin ən biliklisi idi. İllərlə Gövhərşadbəyim mədrəsəsində və İxlasiyyə mədrəsəsində dərs vermək və mühazirə oxumaqla məşğul olmuşdu. Qazı Nizaməddinin ölümündən sonra Gövhərşadbəyim mədrəsəsində tədrisi tərk edib, Abbasiyyə[1529] mədrəsəsində müəllimlik etməyə başladı. Əsərləri cümləsindən: “Şərhi-hikmətül-eyn” (“Varlıq hikmətinin şərhi”).

## 906-CI İLİN (28.07.1500 – 16.07.1501) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın Şirvan padşahı ilə müharibə etməsi

İsgəndər şanlı xaqan Ərzincanda cah-calalla dayandığı zaman orada müridlər və sufilər tayfaları olan ustaclu, şamlu, rumlu, təkəlü, zülqədər, əfşar, qacar, varsaq [tayfalarından] və Qaracadağ sufilərindən yeddi min nəfər, o cümlədən Məhəmməd bəy [Ustaclu] öz övladlarından və tabeçilərindən iki yüz nəfərlə və Abidin bəy Şamlu üç yüz nəfərlə birlikdə cahanın pənahı olan dərgaha toplaşdılar. İsgəndər şanlı xaqan qüdrətli dövlətin ərkanından bəzilərini çağırıb əmr etdi ki, hansı tərəfə hərəkət etməyin gərək olduğunu ordu başçıları ilə[1530] müzakirə etsinlər. Bəziləri dedilər ki, başqa sufilərin və müridlərin dəstə-dəstə orduya qoşulması üçün Ərzincanda qışlaq etmək lazımdır. Bəziləri dedilər ki, bu qışda Gürcüstandakı Qurquraya[1531] qarşı qəzavata gedək. Digər bir firqə isə Çuxursəəddə qışlamağı məsləhət gördü. Ondan sonra dərgah əmirləri ordu başçılarının fərqli fikirlərini ali məqamlı xaqanın qulağına çatdırdılar. O həzrət onların fikirlərini doğru hesab etməyib qərar verdi ki, bu gecə istixarə edəcəyik[1532] və məsum imamlar – onların hamısına Allahın salamı olsun – hər nə buyurarlarsa, onu həyata keçirərik[1533].

Ertəsi gün İsgəndər şanlı xaqan dövlətsevərlik yolunun yolçularını şahlıq taxtının ətəyinə çağırıb buyurdu ki, “cah-calal bayraqlarının Şirvan üzərinə getməsinin doğru və düzgün olması keçən gecə din imamlarının – onların hamısına Allahın salamı olsun – pak ruhlarından bizə aydın və yəqin oldu”. Bu səbəbdən o, hərəkət yüyənini Şirvan tərəfə çevirdi. Pasin mənzilinə gəldikdən sonra onun doğru düşüncəsi belə lazım bildi ki, Xüləfa bəyi Gürcüstan səmtinə göndərsin. Xüləfa bəy fərmana[1534] əsasən bir dəstə dilavərlə[1535] Gürcüstan tərəfə sürətlə yürüş etdi və sonsuz qənimət əldə edərək hökmdarın ordusuna qoşuldu. İsgəndər şanlı xaqan eyni zamanda İlyas bəy Ayqutoğlunu Rüstəmə bənzər sufilərin bir dəstəsi ilə Məntəş qalasını fəth etməyə göndərdi. Əmir İlyas qorxmaz qoşunlarla o asiman əsaslı hasarın üzərinə yollandı. Məntəş qalanı etibarlı adamlarından birinə tapşırıb qaçış bayrağını qaldırdı. Zəfərə yaxın olan qoşun o möhkəm qalanı mərkəz kimi əhatəyə aldı və Məntəşin adamları təşviş içində, qılınc və kəfənlə o qəhrəman əmirin ordusuna tələsdilər.

Beyt

“Boyunlarına kəfən asdılar,
Peşmançılıq yaşını üzlərindən tökdülər”.

O cənab (İlyas bəy) onların başçılarını uğurun məskən saldığı astanaya göndərdi. O həzrət (İsmayıl) hüsn-rəğbət nəzəri ilə o camaata baxdı və o qalanın ixtiyarını onlara qaytardı. Xaqan Axtabad[1536] mənzilində cah-calalla dayandı. Məntəş üzünü hökmdar ordusuna sarı çevirib, xilafət məqamlı astanaya gələrək yalvarış üzünü yol torpağına sürtdü və utanc tozu onun hal camalına qondu. O, sərvərlik səmasının günəşinin (İsmayılın) lütfünə könül verib öz xoşagəlməz hərəkətindən xəcalət çəkdi və hökmdarın mərhəmətinə ümid bağla-

---

1529 Bəzi digər mənbələrə görə: “Qiyasiyyə” (*Nəvai, şərhlər, s.953*).

1530 Məclis nüsxəsi: “bir-biriləri ilə”.

1531 Gürcüstandakı Axaltsix hakimi III Kvarkvare nəzərdə tutulur *(О.А.Эфендиев. Образование азербайджанского государства Сефевидов, с.86).*

1532 Məclis, Nuruosmaniyyə və Bakı nüsxələri: “edəcəyəm”.

1533 Məclis, Nuruosmaniyyə və Bakı nüsxəsi: “keçirərəm”.

1534 Bakı nüsxəsi: “şahın fərmanına”.

1535 Bakı nüsxəsi: “bir dəstə sipahi dilavərlə”.

1536 Baroda nəşri: “Xətabad”; Bodleian nüsxəsi: “Hətabad”; London nüsxəsi: “Hətayabad”. Lakin Nuruosmaniyyə və Məclis nüsxələrində doğru olaraq “Axtabad” yazılmışdır. V.Minorskinin müəyyənləşdirdiyinə görə, Axtaba və ya Axtabad – Tiflisdən Göyçə mahalına gedən yolun üzərində yerləşirdi *(Sazmani-idariyi-hokuməti-Səfəvi, s.194*). Böyük ehtimalla indiki Ağstafa şəhəridir.

dı. O həzrət rəhminin və rəğbətinin çoxluğu üzündən onun qabiliyyətli qamətinə mərhəmət və əfv paltarxanasından ənam və ehsan xələti geyindirdi.

Ondan sonra hökmdar fərman verdi ki, Bayram bəy Qaramanlu zülqədər camaatından [ibarət] bir dəstə ilə qələbə nişanlı məiyyətdən öncə Kür kənarına tələsib Qoyun-ölümü[1537] keçidindən keçsinlər. Əmir Bayram fərmana əsasən çaya doğru yola düşdü. Amma o, həmin keçidi qoşunun keçməsi üçün münasib saymadı və çaş-baş qaldı. İsgəndər şanlı xaqan çay kənarına yetişib köhlən atının yüyənini suya tərəf yönəltdi. Əsgərlər də onun ardınca atlarını suya vurdular və hamısı [çayı] keçdilər. O əsnada Şəki camaatı itaətsizliyə başladı. Qazilər amansız odlu qılıncları ilə onların həyat xırmanını yandırdılar.

Bu zaman *Fərrux Yəsarın adamlarından olan*[1538] bir süvari gəlib çatdı. İsgəndər şanlı xaqan ondan Fərrux Yəsarın əhvalını soruşdu. O dedi:

- Fərrux Yəsarın məclisində söz düşdü ki, İsgəndər şanlı xaqan Şirvana gəlməkdədir. Şirvanşah dedi ki, əgər o, bu hüduda gələrsə, onun atasının başına gələn onun da başına gələcəkdir[1539].

İsgəndər şanlı xaqan bu xəbəri eşidəndə anladı ki, şirvanşahın fitnə atəşi iti qılınc işlədilmədən söndürülməz və Şirvan qoşununun tüğyan selinin qarşısı mərdanə həmlənin sərsəri küləyindən başqa heç nə ilə alınmaz. Buna görə də o, firavan ordu ilə Gəldi-Gilana[1540] yönəldi. O məkanın sakinləri İsgəndər şanlı xaqana ərz etdilər ki, şirvanşah öz məiyyəti və ordusu ilə Qəbələ qalasının ətəyində oturmuş, sülh və asayiş qapısını öz üzünə bağlamışdır. Ondan sonra Cəmşid məqamlı padşah[1541] Şamaxıya yönəldi.

O əsnada xəbər çatdı ki, Şirvan padşahı naqis imanlı firqə ilə Biqurd[1542] kənarındakı meşəyə gəlmiş və öz ətrafına çəpər çəkdirmişdir. Şamaxıya çatan İsgəndər şanlı xaqan oradan Cəbaniyə yollandı.

O tərəfdən şirvanşah məiyyət və ordu ilə gəlişinin şəfəqini Cəbani mövqeyi üzərinə saldı. Müxaliflərin yaxınlaşmasından agah olan İsgəndər şanlı xaqan yeddi min nəfərdən ibarət qələbə şüarlı ordusunu hazırlamağa başladı. Fərrux Yəsar yanında olan iyirmi min nəfər süvari və altı min nəfər yaxşı silahlanmış piyada ilə bir təpənin altında mövqe tutdu və öz qoşununu tərtib etməklə məşğul oldu. Ondan sonra dava axtaran igidlər və döyüşkən bahadırlar kin meydanına atılıb yeri-göyü lərzəyə gətirdilər. Pəhləvanlıq yolunun yolçularının əlindəki yəməni qılınc baş kəsməyə başlayıb insanın ruhunun quşunu fani bədən qəfəsinin darısqallığından uçurdu. Nizə əjdahası qocaya və cavana tənə vurmaq üçün dilini uzatdı. Qraniti dələn ox savaş meydanı igidlərindən hər birinin cismində neçə-neçə qanlı çeşmələr yaratdı. Qalxan öz alnını qəzəblə qırışdırıb bərk üzünü qabağa tutdu.

Nəzm

“Qalxan qaşlarını çatdı,
İkiüzlü qılıncla həmsöhbət oldu”.

O əsnada şirvanşah azğın tayfadan [ibarət] bir dəstə ilə igidlik ayağını önə qoydu və tez pərvaz edən oxu kaman yuvasından buraxıb döyüşdə elə ciddi-cəhd göstərdilər ki, onların qaniçən oxlarının qorxusundan, şiddətli intiqamçı olan Bəhram günəşin zərnigar qalxanını başına çəkdi.

Nəzm

“Qalxanlar oxdan dəlmə-deşik olmuşdu,
Ondan nəzər edirdilər döyüşçülər.
Yetərincə oxdan bədən dəmirə döndü,
Heç kəsin cövşənə ehtiyacı olmadı.
Yetərincə baş düşdü, meyvə budaqdan düşən kimi,

[1537] Qoyun-ölümü keçidinin indiki Yevlax rayonu və ya Mingəçevir şəhəri zonasında yerləşdiyi təxmin edilir (*N.Musalı. I Şah İsmayılın hakimiyyəti, s.130*).

[1538] Bakı nüsxəsi (22b).

[1539] Bakı nüsxəsi: “Fərrux Yəsar məclisdə söylədi ki, bir dəstə əsgər göndərməklə sizin qoşununuzun işini bitirəcəkdir və özünün hərəkətə keçməsinə ehtiyac yoxdur”.

[1540] Nuruosmaniyyə və Bodleian nüsxələri: “Gələd-Gilan”; Məclis nüsxəsi: “Gəldi-Gilan”; Baroda nəşri və London nüsxəsi: “Kilidi-Gilan”. Şəki tarixinin tədqiqatçısı A.Məmmədov Bədr Şirvani divanını əsas alaraq bu toponimi “Gəldi-gələn” / “Gəldin-gələn” kimi oxumağı təklif edir.

[1541] Bakı nüsxəsi: “ali məqamlı şah”.

[1542] Biqurd qalası (Qəleyi-Biqurd) – Şamaxı şəhərindən şimal-qərbdə, indiki Şamaxı rayonunun Qalaybuğurd kəndi yaxınlığında yerləşən orta əsr qalası.

Qarğa ilə kərkəsin ruzisi bol oldu".

Şirvanlıların ürək nişan alan oxları onların işi kimi enişə üz qoyub dəbilqəni başa tikirdi və qazilərin atəş saçan nizələri onların dövlətinin ucaldığı kimi [odlu] dilini yuxarı uzadıb həyat xırmanını yandırırdı. O əsnada ox yağışı üzündən[1543] ali məqamlı xaqanın sağ və sol cinahları bir-birinə qarışdı. Fərrux Yəsar cəsarətlənib ordusunun süvariləri ilə birdən həmlə etdi. Şirvan piyadaları minik heyvanlarının əl-ayağı altına düşüb daha ox atmağa macal tapmadılar. Şirvanşah qoşununun igidləri kin atəşinin hiddətindən külək kimi gəlirdilər, yağış suyu kimi yerə düşürdülər; bəziləri həyat suyunu ölüm küləyinə verirdi və atəş saçan nizənin vurduğu yaranın şiddətindən kinlə dolu sinələrini torpağın üstünə qoyurdular. O əsnada İsgəndər şanlı xaqan hər biri savaş zirvəsinin[1544] pələngi və döyüş dənizinin nəhəngi (timsahı) olan dilavərlərdən [ibarət] bir dəstə ilə igidlik atını düşmənlərin üzərinə çapıb hər həmlədə onların bir qismini həlak torpağı üstünə sərdi. Axırda şahın dövlətinin qüvvətinin, bəlkə də, məhz İlahi yardımın sayəsində fəth və zəfər yeli alinəsəb xaqanın bayrağının pərçiminə əsdi və şirvanlıların gözünə bədbəxtlik tozu səpdi. Onlar (şirvanlılar) bütün yüklərini və əşyalarını, dağ kimi heyvanlarını döyüş meydanında qoyub, "canını qurtaran qazanclı çıxdı" məsəlində deyildiyi kimi, qaçmağı qənimət bildilər.

Beyt

"Şirvan süvariləri o vurhavurda,
Qaçış yoluna çıxdılar".

Şirvanşah pərişan və üzü qara halda Biqurd qalası tərəfə fərar etdi. Müzəffər əsgərlərin bir dəstəsi onu təqib edirdilər, lakin onun şirvanşah olduğunu bilmirdilər. Qalanın yaxınlığında arxadan ona çatıb, atdan aşağıya endirərək başını bədənindən ayırdılar, yarağını və atını ələ keçirdilər. Şirvanşah qoşununun qazilərə əsir düşmüş bir sıra əsgərləri onun atını tanıdılar. Ondan sonra onun başını cəsədi ilə birləşdirib yandırdılar və qətlə yetirilmişlərin kəllələrindən minarələr düzəltdilər.

İsgəndər şanlı xaqan üç gün o məkanda qaldıqdan sonra Şamaxıya yollandı. O şəhərin ətrafında seyidlər, qazılar, ağalar, əhali və əyan-əşrəflər o həzrəti qarşılamağa tələsib büsatı öpmək şərəfinə nail oldular. İsgəndər şanlı xaqan Şirvan taxtında əyləşib rahatlandı. O əsnada xəbər çatdı ki, döyüş günü fərar etmiş Fərrux Yəsar oğlu Şeyxşah indi Şəhrinovda[1545] qərar tutmuş və Şirvan qoşununun qılıncdan qurtulanları onun yanına cəmləşmişlər. O həzrət Xüləfa bəyi qələbə nişanlı ordu ilə Fərrux Yəsar oğlu Şeyxşahı dəf etməyə göndərdi və hökmdarın məiyyəti də o tərəfə doğru hərəkətə gəldi. Ali məqamlı xaqanın gəlişindən xəbər tutan Şeyxşah gəmiyə oturub Gilan tərəfə tələsdi. Şeyxşahın fərar etməsinin xəbəri mələklər ordusuna malik şaha çatdıqda qışlaq etmək üçün Mahmudabada yönəldi.

Qışlaq əsnasında xəbərçilər hökmdara belə bir doğru xəbər ərz etdilər ki, Bakı qalasının sakinləri xərac ödəməyin zərurətlərini yerinə yetirmirlər. Ora möhkəmliyi ilə ad çıxarmış və mətanəti ilə tanınmış bir qala idi. Sanki "And olsun bürclər sahibi olan göyə"[1546] onun haqqında bir ayədir və "Üstünüzdə yeddi [qat] möhkəm göy qurduq"[1547] onun istehkamı haqqında bir işarədir.

Şeir

"Başı keçib asimandan şübhəsiz,
Sanki digər bir yerdir asimanda.
Küngürəsinin başı fələkdən faydalanır,
Göyün ən uca zirvəsinin tağına əl vurub.
Qapısı səba küləyinin qalxmaq yolunu kəsib,
Zatül-büruc[1548] kimi bünövrəsi qüvvətlidir.
Alicənablar kimi başı fələyə çatır,
Alçaqlar kimi xəndəyi Səməkin belinə çatır".

---

1543 Baroda nəşri: səhvən "O əsnada şübhə üzündən" yazılmışdır.
1544 Baroda nəşri: "savaş qalasının".
1545 Şəhrinov – Şirvanın Xəzər dənizi sahillərində yerləşən tarixi şəhər.
1546 *Qurani-Kərim, "Büruc" surəsi, 1-ci ayə.*
1547 *Qurani-Kərim", "Nəbə" surəsi, 12-ci ayə.*
1548 Zatül-büruc – göyün səkkizinci qatı.

Ali əmr verildi ki, böyük əmirlərdən Məhəmməd bəy Ustaclu və İlyas bəy Ayqutoğlu Xınıslu Bakı tərəfə getsinlər və o qalanı almağa çalışsınlar. Əmirlər o həzrətin əmrinə əsasən o tərəfə getdilər və qalanı mərkəz kimi əhatə (mühasirə) etdilər. Qala əhli can qorxusundan ox və daş atırdı və zəfər nişanlı qoşunlar mətanət qalxanlarını başlarına çəkib, düşmənlərin ürəklərini göz deşən oxlarla oxlayırdılar. Neçə gün bu minvalla döyüş və vuruş davam etdi. Ondan sonra zəfərə yaxın olan xaqan o möhkəm qalaya yönəlib əmirlərə qoşuldu və qalanın hakimi olan Qazı bəyin arvadının yanına adam göndərdi ki, öyüd-nəsihətlə onu sülh yoluna dəvət etsin. O isə elçini qətlə yetirdi. Ondan sonra Qazı bəyin tərəfindən Bakı daruğası olan Əbülfəttah bəy həmin arvadın yanına gedib onu xaqanın qəzəbi ilə qorxutdu. [Arvad] onu da qətlə yetirdi. Ondan sonra qazilər lağım atmaqla məşğul oldular. Mətin qüvvətlə İsgəndər səddini Xeybər qalası kimi kökündən yıxan çevik əllərə sahib lağımçılar və balta vasitəsilə dağı arı pətəyi kimi parça-parça edən güclü qollara malik dağ yaranlar,

“Qraniti balta ilə mum kimi edən,
Güclü biləkli, polad kimi adamlar”,

o möhkəm qalanın altından bir lağım vurdular. Lağım vuran zaman böyük bir daşa (qayaya) rast gəldilər və sirkə vasitəsilə o daşı parçalayıb qalanın bir bürcünü uçurtdular. Qala sakinləri alaçıq keçələri ilə bu uçulmuş yeri tutdular və daha üç gün qalanı qorudular. Ondan sonra əzəmətli qazilər yürüş etdilər.

“Döyüşkən igidlər məst fillər kimi,
Qalanı açmaq (almaq) üçün əl açdılar.
Həmin müzəffər qartallar,
O yüksək asimana tərəf sürətlə uçdular.
Əllərindən qala divarı çökdü,
Beləliklə, yüksəklik alçaqlıqla əvəz olundu.
Çəkinmədilər nə oxdan, nə də daşdan,
Tutdular həmin qalanı yubanmadan”.

Qısa zamanda o qalanı ələ keçirdilər, kəsici qılıncın və can alan nizənin zərbəsi ilə bir dəstəni qətlə yetirdilər. Bakı əyanlarından təxminən yetmiş nəfər əllərində “Qurani-Məcid” kitabları tutaraq əl-aman fəryadını Keyvan eyvanına çatdırdılar. İsgəndər şanlı xaqan onların təqsirindən keçdi. Bakı sakinləri dövlət xəzinəsinə (“xəzaneyi-amirə”) qan bahası (“xunbaha”) şəklində min tümən ödədilər. Əzəmətli qazilər *Həzrət Sultan Cüneydi şəhidlik izzətinə çatdırmış*[1549] Mirzə Xəlilullanın qəbrini açdılar və onun cəsədini bayıra çıxarıb yandırdılar[1550]. Onun günbəzində çoxlu qızıl tapdılar. İsgəndər şanlı xaqan Bakı qalasını zəbt etdikdən sonra hərəkət yüyənini Gülüstan qalasına tərəf yönəltdi. Çünki Şirvan qoşunları orada yerləşmişdilər və öz ürək lövhələri üzərində müxaliflik xəyalını əks etdirmişdilər. O əsnada qala sakinləri ali əşrəfə ərz etdilər ki, Biqurd qalası Qazı bəyin oğlunun əlindədir, Sürxab qalası isə Qazı bəyin öz əlindədir[1551] və hərgah həmin qalalar qüdrətli dövlətinizin sərkərdələrinin əlinə keçərsə, biz də qalanı könüllü surətdə təslim edərik.

O əsnada əlahəzrət məsum imamlardan – onların hamısına Allahın salamı olsun – biri İsgəndər şanlı xaqanın yuxusuna girib ona əmr etdi ki, Gülüstan qalasının ətəyindən qalxıb hərəkət yüyənini Azərbaycana doğru yönəltsin. Səhər çağı fələk bürcündən günəşin baş qaldırmasından sonra İsgəndər şanlı xaqan Hüseyn bəy Lələ, Abdal bəy Dədə, Məhəmməd bəy Ustaclu, Əbdi bəy Şamlu və Xadim bəy kimi qüdrətli dövlətin ərkanını çağırıb onlara dedi:

- Azərbaycanı istəyirsiniz, yoxsa Gülüstan qalasını?

Onlar dedilər:

- Azərbaycanı!

O həzrət buyurdu:

- Keçən gecə bizə din imamlarından və yəqinlik yolunun bələdçilərindən varid olmuşdur ki, əgər Azərbaycanı istəyirsənsə, Gülüstan qalasının ətəyindən qalx!

---

[1549] Bakı nüsxəsi (25a-b).

[1550] Lakin 1945-1947-ci illərdə Şirvanşahlar sarayındakı türbədə aparılan arxeoloji kəşfiyyat işləri zamanı türbədə açılmış qəbirlər bu məlumatın dəqiq olmadığını göstərir *(Ş.K.Məmmədova.”Xülasət ət-təvarix” Azərbaycan tarixinin mənbəyi kimi, s.65).*

[1551] Baroda nəşri: “Sürxab qalası da onun əlindədir”; Məclis nüsxəsi: “Sürxab qalası isə atasının əlindədir”.

Əmirlər səcdəyə düşdülər və Allaha dua etməyə başladılar. Ondan sonra o həzrət Azərbaycana yollandı.

## Mavəraünnəhrdə baş vermiş hadisələr və Şeybək[1552] xan Özbəyin Səmərqəndi tutması haqqında söhbət

Bu il Şeybək xan Şeybani ölkə ələ keçirməyi özünə yol seçmiş bir dəstə ilə birlikdə Səmərqənd fəthinin küngürəsinə çalışqanlıq kəməndini saldı (Səmərqəndi fəth etməyi qərara aldı). O, əmirlərlə, dövlət ərkanı ilə və heybətli moğollarla o şəhərin kənarına gəldi və çadırını, alaçığını, saray pərdəsini günəşlə ayın eyvanına yüksəltdi. Sultan Əli mirzə ibn Sultan Mahmud ibn Sultan Əbu-Səid səhra savaşına gücü çatmadığından [şəhər] divarları arxasına sığındı. Aləmi yandıran özbəklər təqribən on gün[1553] [şəhər ətrafında] dayandılar. O vaxt həmin azğın tayfa pusquda bir dəstə qoyub Şeyxzadə darvazasına yaxınlaşdı. Səmərqənd ordusu bayıra çıxdı və özbəklərə həmlə etdi. Onlar qarşı tərəfi aldatmaq üçün savaş meydanından qaçmağa başladılar və şəhərliləri səhranın içinə çəkdilər. Şeybək xan bir dəstə bahadırla gözlənilmədən pusqudan çıxdı və həmlə etdi. Böyük bir döyüş baş verdi və səmərqəndlilər məğlub oldular. Şeybək xan Çaharrahə (Dördyol) darvazasına tərəf tələsib orada da ağır bir döyüşdən sonra səmərqəndlilərə qalib gəldi, müzəffər və qalibiyyətli halda öz ordusuna qayıtdı.

O əsnada xəbər çatdı ki, Məhəmməd Bağır xan[1554] təqribən on min cavan toplayıb Sultan Əli mirzənin köməyinə gəlir. Ona görə də Şeybək xan çoxsaylı bir ordu ilə müxaliflərini qarşılamağa tələsdi. Dəbusi qalası ətrafında qarşıdurma və vuruşma baş verdi. Əmir Məhəmməd Bağır məğlub olub Dəbusi qalasına çəkildi. Şeybək xan Buxaraya yönəldi. Oraya çatdıqdan sonra mühasirəyə və müharibəyə başladı. Buxaralılar üç gün şəhəri qorudular. Dördüncü gün Mövlana Məhəmməd Əli Qazı Xarəzmini bol peşkəşlərlə xanın hüzuruna göndərdilər. Şeybək xan Buxara hakimliyini Əmir Məhəmməd Saleh Bayata lütf etdi və Səmərqəndə yollandı[1555]. O əsnada Mirzə Məhəmməd Salehin qasidi gəlib məruzə etdi ki, Əmir Məhəmməd Bağır Dəbusi qalasından çıxıb sürətlə Qərşiyə gəlmişdir. Ona görə də Şeybək xan Buxaraya tərəf qayıtdı. Yaxınlaşmaqda olan Əmir Məhəmməd Bağır Qərşiyə tərəf geri döndü.

Şeybək xan Buxaraya çatdıqdan sonra şəhərin tarac olunmasını hökm etdi. Bu səbəbdən özbəklər soyğun və qarət süpürgəsi ilə şəhəri pak etdilər. [Şeybək xan] Buxara hakimliyini öz qardaşı Mahmud sultana tapşırıb Səmərqəndə yollandı və şəhərin ətrafında dayandı. O zaman şəhər Xoca Abdullanın oğlu Xoca Yəhyanın əlində idi. Sultan Əli mirzə ibn Sultan Mahmud ibn Sultan Əbu-Səid hər gün xocanın yanına gedir, onun buyruğuna qarşı çıxmağı qeyri-mümkün sayırdı. Şeybək xan bir neçə gün [şəhəri] mühasirədə saxlamaqla və səmərqəndlilərlə müharibə etməklə məşğul olduqdan sonra bildi ki, Sultan Əli mirzə Xoca Yəhyadan təngə gəlmişdir. [Şeybək xan, Sultan Əli mirzənin yanına] adam göndərib ona belə bir ismarış çatdırdı: "Belə məlum oldu ki, Xoca Yəhya bu günlərdə ağalıq etməkdədir və dövlət işlərini öz əlində cəmləşdirmişdir. Bizim səylərimiz sənin halının rahatlığına və rifahına yönəldilmişdir. Münasib olan budur ki, bizim yanımıza gələsən və mənim doğma övladlarımın silkinə daxil olasan". Həmçinin Sultan Əli mirzənin anasına da məhəbbət və sevgi ilə dolu bir məktub ("rüqə") göndərib onunla evlənəcəyinə söz verdi. Şahzadə həmin sadəlövh qadınla birlikdə üç yüz nəfər bacarıqlı süvari ilə xanın ordusuna gəldi. Şeybək xan o sadədil şahzadə ilə Kanigüldə[1556] görüşüb axırda onu qətlə yetirdi. Xoca Yəhya da xanın dərgahına gəldi və əksər dostları-qardaşları ilə birlikdə qətlə yetirildi. Səmərqənd, Türküstan və Buxara məmləkəti Şeybək xanın ixtiyarına keçdi. O, Kanigüldə özünə mənzil seçdi və rəiyyətin mallarına təcavüz əlini uzatdı.

Dörd aydan sonra hidayət sahibi Əbdülcəlil Mürğinaninin övladlarından Xoca Əbülməkarim Əndicanda öz atası Ömərşeyx mirzənin yerinə oturan Məhəmməd Babur padşahın yanına bir qasid göndərdi və buyurdu: "Münasib olan odur ki, şahzadə məsafələri elə qət etsin ki, filan gecədə Səmərqəndə çatsın və mən

[1552] Bakı nüsxəsi: "Şahibəy".
[1553] Baroda nəşri: "iki gün".
[1554] Buxara hakimi Əmir Məhəmməd Bağır Tərxan nəzərdə tutulur *(Nəvai, şərhlər, s.961).*
[1555] Bakı nüsxəsi: "Şahibəy xan Buxaraya yönəldi. Mirzə Məhəmməd Saleh, Mövlana Məhəmməd Əli Xarəzmini bol peşkəşlərlə xanın hüzuruna göndərdi. Şahibəy xan Buxara hakimliyini əvvəlki qaydada Mirzə Məhəmmədə lütf edib Səmərqəndə yollandı".
[1556] Kanigül – Səmərqənddən iki mil şərqdə yerləşir *(Seddon, şərhlər, s.224).*

bəndə şəhər darvazasını onun üzünə açım". Bu xəbər Babur mirzəyə çatdıqda sevimli bahadırlarından iki yüz qırx nəfərlə birlikdə Səmərqəndi ələ keçirmək üçün yola çıxdı və elə təcili surətdə hərəkət etdi ki, heç bir mənzildə səba mehindən başqa bir kəs onu qabaqlaya bilmədi və yol getmək zamanı heç kəsi özündən irəliyə buraxmadı. Onun günəş görkəmli çətiri hər gecə ay kimi mənzilləri qət edir və gündüzlər haraya çatırdısa, qütb kimi aram tapırdı. Nəhayət, o, vəd olunan gecə Səmərqənd darvazasına çatdı. Xoca Əbülməkarim o həzrəti şəhərə daxil edib darvazaları bağlatdırdı. Ondan sonra Məhəmməd Babur padşah səmərqəndlilərin təhriki ilə xanın adamlarından təqribən beş yüz nəfəri qətlə yetirdi. O gecə Xoca Qütbəddinin evində qalan Canvəfa mirzə səmərqəndlilərin təhriki əsasında Mövlana Əbdürrəhim Türküstani ilə və Şeybani xanın mülazimləri ilə birlikdə fərar etdi. Həmin vaxt Şeybək xan səkkiz min süvari və piyadadan ibarət güclü bir qoşunla Didar qalası[1557] ətrafında əzəmət və iqtidar çadırlarını dövr edən fələyin zirvəsinə ucaltmışdı. Həmzə sultan və Baqi sultan bir dəstə bahadırla şəhər yaxınlığındakı qoruqda[1558] idilər.

Bu möhnətli xəbər alinəsəb xana çatdıqda böyük bir ordu ilə dəmir darvazanın qarşısına gəldi. Bir iş görə bilməyəcəyini başa düşdüyündən Türküstana yollandı. Məhəmməd Babur padşah min süvari ilə xanın arxasınca sürətli yürüş etdi və Xoca-Kardzən[1559] mövqeyində bir xəndək qazdırdı. Bir gecə Şeybək xan bir dəstə igidlə gecə basqını edib Babur astanasının qılınc qurşananlarının və dilavərlik meydanının çevik süvarilərinin əli ilə məğlubiyyətə uğradıldı. Babur padşah xəndəyi qoyub Şeybək xanın düşərgəsinə yönəldi. O tərəfdən də Şeybək xan səkkiz min süvari ilə Babur padşahın qarşısında döyüş səfi tərtib etdi. Həmin gün Babur padşahın xidmətində qılınc vuran min süvaridən başqa kimsə yox idi. O həzrət "Kim Allaha təvəkkül etsə, Allah ona kifayət edər"[1560] [ayəsinin] möhkəm dayağından yapışaraq yanındakı az adamla səkkiz min qulyabanı görkəmli və ifrit sifətli özbəyin qarşısında döyüş səfi tərtib etdi. İti qılınclarını qından sıyırdılar və düşmənlərə həmlə etdilər.

Nəzm

"Çəkdilər almaz kimi [iti] qılıncı qılafdan,
Qır dənizindən saf su çıxdı sanki".

Əjdahaya bənzər qılınc savaş dəryasının nəhəngləri (timsahları) kimi üzüb düşmənlərin həyat gəmisini ölüm girdabında qərq edirdi və qan saçan oxun ucu özbəklərin könül gözünü Bədəxşan ləli kimi edirdi (qana bələyirdi).

Nəzm

"Başdan-başa o döyüş meydanında,
Oxdan göbəyə ağrı düşdü.
Gözəllərin kipriyi (ox) fitnə axtarmağa başladı,
O, aşıqların bədəninə can damarı (şah damar) oldu".

Şeybək xanın [ordusunun] sol cinahı (cəvanğar) yüyənini qaçış vadisinə yönəltdi. Özbəklərin əmirləri xana dedilər:

- Bizim qoşunlarımız alt-üst olmuşdur. Yaxşısı budur ki, fərar edək.

Şeybək xan bir daha bahadırlara döyüş atəşini alışdırmağı əmr etdi. Bir daha qalmaqal və şərlə dolu özbəklər o bədbəxtin bayrağının kölgəsində cəmləşdilər. Bir dəstə [özbək] Babur padşahın arxasına keçib ox atışına başladı. Babur padşah müqavimət göstərməyə aciz qalıb Səmərqəndə üz tutdu. Elə ki o şəhərə çatdı, müdafiə olunmağa qərar verərək [şəhərin] bürcünü və divarını möhkəmlətdi. Şeybək xan çoxlu qoşunlarla Səmərqənd ətrafına gəlib şəhəri bir mərkəz kimi əhatəyə aldı. Mühasirə müddəti uzandığından Səmərqənddə ağır bir qıtlıq baş verdi. Ona görə də Babur padşah Səmərqəndi tərk edib Əndicana yollandı. Şeybək xan şəhərə daxil olub [şəhərin] böyüklərini qətl etməyə başladı. Xoca Əbülməkarim, heç kəs onu tanımasın deyə, öz saqqalını qırxıb Türküstana üz qoydu və özbək qoşunundan bəziləri onu tanıyıb xanın yanına apardılar. Xan soruşdu:

- Saqqalını nə etdin?

[1557] Didar qalası – Səmərqənd yaxınlığındadır *(Seddon, şərhlər, s.224).*
[1558] "Həbibüs-siyər"də bu qoruğun adı "Budinə qoruğu" kimi yazılmışdır *(Nəvai, şərhlər, s.963).*
[1559] Baroda nəşri: "Cuciyə-karvan"; Nuruosmaniyyə nüsxəsi: "Huhə-kardan"; Bakı nüsxəsi: "Xusə-karvan".
[1560] *Qurani-Kərim, "Talaq" surəsi, 3-cü ayə.*

Xoca cavabında bu beyti oxudu:

"Tanrının yandırdığı çırağı üfürən,
Öz saqqalını yandırar".

Amma bu lətifənin faydası olmadı. Cəza qəhrəmanı (Şeybək xan) xocanı axirət aləminə göndərdi. Şeybək xan Səmərqəndi paytaxt (darülmülk) edib Türküstan hakimiyyətini öz əmiləri olan Kuçunci xanla Sevincək sultana bağışladı. Onların anası Mirzə Şahruxun oğlu Mirzə Uluğ bəyin qızı idi. Buxara hakimliyini isə öz qardaşı Mahmud sultana verdi. Ondan sonra ardıcıl və dalbadal surətdə şimşək əlamətli özbək ordusunu Hisari-Şadmana, Xüttəlana, Qunduza və Bəğlana basqın etməyə göndərdi və hökmranlıq bayrağını yüksəltdi.

**Rum vilayətində baş vermiş hadisələr haqqında söhbət**

Bu ilin əvvəllərində Rum padşahı Sultan Bayəzid Koron və Modon şəhərlərinə yönəldi. O şəhərlər yunan adalarındandırlar. Bir aydan sonra ali məqamlı hökmdar Moraya çatdı. O, digər tərəfdən, hamısı geniş ürəkli və cəsur olan başqa bir qoşunu səma simalı gəmilərlə və ildırım sürətli qayıqlarla Yaqub paşa ilə Davud paşanın[1561] sərkərdəliyi altında göndərdi. Qarşı tərəfdən də Venedik valisi və digər Firəng padşahları savaş üçün Əlvənd [dağına][1562] bənzəyən üç yüz gəmi göndərdilər ki, rumilərin gəmilərinə müqavimət göstərsinlər. Rum qoşunları o qalmaqalçı qövmün gəlişini məlum etdikdə Cudi[1563] dağına bənzəyən böyük gəmilərlə dəstə-dəstə, əzəmət və şövkətlə onları qarşılamağa tələsdilər. Döyüş zamanı top və tüfəng zərbəsi nəticəsində pozğun firəng kafirlərindən neçə min nəfərin sinə sandığı qırılmış gəmilər kimi dənizin üzünə düşdü və o zəbun kafirlərin qanla dolu ürəklərinin qayıqları su üstündəki köpük alaçıqları kimi titrəməyə başlayıb iztiraba düçar oldu. Rumilər tədbir qarmaqları ilə dörd mavnanı ələ keçirdilər. Bunların hərəsində min adam vardı və onların hamısını yoxluq diyarına yolladılar. O əsnada külək həmin bəxti dönmüş qövmün istəyinin əksinə əsməyə başladı. Ona görə də kafirlər gəmi yelkənlərini fərar səmtinə doğru yüksəltdilər.

Rumilər Modon qalasını qurudan və dənizdən mühasirəyə aldılar və qazğan zərbəsi ilə hasarın bürclərini müşriklərin ürəyi kimi viran etdilər. Şəhər və qala əhli Firəng padşahından və Venedik valisindən kömək istədilər. Qala əhlinin çarəsizliyi səbəbindən Venedik hakimi dörd ədəd külək rəftarlı gəmini çoxsaylı cavanlarla birlikdə qala camaatının yardımına göndərdi ki, qəflətən özlərini qalaya salsınlar. Onlar rumilərin üç yüz gəmisindən keçib özlərini qala divarlarına yetirdilər və dərhal öz gəmilərinə od vurdular. Rum ordusu bu hadisədən qəm-qüssəyə qapıldı. Şəhər əhli isə son dərəcə sevinc içində onlara tərəf qaçdılar, onların top-tüfəngini daşımaqla məşğul oldular və [qala] divarlarının hündürlüyünə olan etimadlarından dolayı hasar bürclərini mühafizəçilərdən xali (boş) qoydular. Bu əsnada Anadolu əmirülümərası Sinan paşa igidlik meydanının dilavərlərindən [ibarət] bir dəstə ilə qala boşluğuna tərəf hücuma keçib bürcün üzərinə çıxdı. Bəxti dönmüş kafir camaatı sevinc və şadlıq əsnasında Rum ordusunu [qala] divarının başında gördü və sərsəm halda onların üzərinə cumub, can qorxusundan qılınc və nizəyə əl atdı. Sultan mübarizlərə kömək üçün ordunu dəstə-dəstə içəri göndərirdi. O gün səhərdən axşamacan Əzrail öz işi ilə məşğul oldu. Müşriklər can qorxusundan mağaralara, dəlmə-deşiyə və möhkəm evlərə pənah apardılar. O qaragün qövm növbəti gündüzə qədər döyüşdü və son dərəcə çarəsiz qaldıqlarından, daşları və taxtaları neft və şora ilə yandıraraq rumilərin üzərinə atdılar. Şəhərə yanğın düşdü. O şərəfsiz tayfa (kafirlər) dəstə-dəstə yandı. Yaramazların qətlindən sonra qırmızı və ağ sikkələrdən, göyçək görkəmli qızlardan və günəş surətli oğlanlardan [ibarət] çoxlu qənimət ələ düşdü. Hər biri Çin nigarxanasını qısqandıran və Ərjəng[1564] nəqşinə həsəd bəxş edən Firəng gözəlləri və yasəmən kimi ağ üzlü mədəni qızlar dustaq və əsir edilib, divarlara nəqş edilmiş surətlər kimi evlərin içində giriftar oldular. Sultan o diyarın fəthindən sonra İstanbula qayıtdı.

---

[1561] Baroda nəşrində "İsgəndər paşa" yazılmışdır.

[1562] Əlvənd dağı – Həmədan yaxınlığında yüksək bir dağdır.

[1563] Cudi – "Qurani-Kərim"ə görə, Nuh peyğəmbərin gəmisinin tufandan sonra üzərinə oturduğu dağ *(H.Tanyu. Cûdî dağı // TDVİA, cilt: 8, yıl: 1993, s.79-80).*

[1564] Ərjəng – məşhur rəssam Maninin çəkdiyi şəkillərdən ibarət kitab, rəsm məcmuəsi *(İ.Pala. Ansiklopedik divan şiiri sözlüğü, s.297).*

### Xorasan vilayətində baş vermiş hadisələr haqqında söhbət

Məhəmməd Hüseyn mirzənin hökmranlıq etməsi barədə xəbərlər ardıcıl və dalbadan surətdə Sultan Hüseyn mirzəyə çatdığından hərəkət bayrağını Astarabad səmtinə doğru yüksəltdi. Yol əsnasında Müzəffər Hüseyn mirzə ilə Əmir Məhəmməd Bərəndüq Barlas ulduzlar kimi (parlaq) dərgaha gəlib iltifatlı nəzərlə qarşılandılar. Yüksək məqamlı atasının gəlişindən xəbər tutan Məhəmməd Hüseyn mirzə fərar vadisinə tələsdi. Sultan Hüseyn mirzə mənzilləri qət etdikdən sonra Astarabadda cah-calalla dayandı. O əsnada Köpək mirzə böyük rütbəli atasının hüzuruna gəlmək üçün ehram bağladı. Padşah, Əmir Məhəmməd Bərəndüqü onu qarşılamağa göndərdi. Əmir Məhəmməd şahzadəyə qoşulub onunla birlikdə hökmdarın ordusuna yollandı. Bu əsnada Məhəmməd Hüseyn mirzə onların üzərinə sürətli yürüş edib, Köpək mirzənin ordusunun əksəriyyətinin arpa və saman toplamaq üçün dağıldıqları bir yerdə ordugahın kənarına çatdı. Köpək mirzə ilə Əmir Məhəmməd Bərəndüq qaçmağı döyüşməkdən üstün tutdular. Onların bütün mallarını Məhəmməd Hüseyn mirzə qənimət kimi ələ keçirib Ətrək çayı tərəfə qayıtdı. Köpək mirzə Püli-səngin (Daş körpü) üzərində zəfərə yaxın olan padşahın əlini öpməklə feyzyab oldu.

O əsnada Məhəmməd Hüseyn mirzə bol peşkəşlərlə yaxşı nitq qabiliyyətinə malik qasidləri o yüksək şanlı padşahın dərgahına göndərdi və o həzrət Astarabad səltənətini ona verib Herata yollandı[1565].

### Yəzddə baş verənlər haqqında söhbət[1566]

Luristandakı Kərrə adlı yerdən olan Rəis Məhəmməd Kərrə adlanan şəxs bu il Yəzd hakimi Murad bəy Bayandurun qardaşı Şeyxəli bəyin mülazimi idi. Bir gün Şeyxəli bəy ov üçün Əbərquhdan çıxmışdı. Kərrə, Şeyxəli bəyin hüququnun dəftərini unutqanlıq tağı üzərinə qoydu və bir dəstəni özünə müttəfiq etdi. Hamısı birdən Şeyxəli bəyin mülazimlərinin üstünə gedib onları şəhərdən çıxardılar və o şəhəri ələ keçirdilər. Şeyxəli bəyin müqavimət göstərməyə taqəti olmadığından onun yanına adam göndərdi və adamlarını [onun əlindən] geri alıb Yəzdə yollandı. Kərrə Luristana yaxşı nitq qabiliyyətinə malik adamlar göndərdi və [özünə] mülazim istədi. Ona görə də üç min lur onun yanına Əbərquha gəldilər. Onlardan kömək alan Kərrə Bəvvənatı[1567] da ələ keçirdi.

### Müxtəlif əhvalatlar

İllərlə Ağqoyunlu sultanlarına vəzirlik etmiş Əmir Şəmsəddin Zəkəriyya bu il İsgəndər şanlı xaqanın büsatını öpmək şərəfi ilə iftixar qazanıb başı uca oldu. Şahanə lütfkarlıq onun halına şamil olundu və ali divan vəzirliyi mənsəbi ona verildi. Sədarət isə Mövlana Şəmsəddin Gilaniyə həvalə edildi.

Həmçinin bu il Sultan Hüseyn mirzə İmam Rzanın müqəddəs, nurlu və mübarək Məşhədinin, Əbivərdin, Nisanın və Bavərdin[1568] idarəçiliyini Köpək mirzəyə lütf etdi.

Bu il Əbülmöhsün mirzə eşitdi ki, Sultan Hüseyn mirzə Məşhəd hakimliyini Köpək mirzəyə verib. O da [Sultan Hüseyn mirzənin] hüzuruna tələsdi və padşah tərəfindən rəğbətlə qarşılandı.

### Ölümlər

Fərrux Yəsar ibn Əmir Xəlilulla ibn Sultan İbrahim ibn Sultan Məhəmməd ibn Keyqubad ibn Fərruxzad ibn Mənuçöhr. Sonuncu adı çəkilən şəxs (Mənuçöhr) "Xaqan" [ləqəbi] ilə məşhur idi və şirvanlı şair Xaqani öz təxəllüsünü ondan almışdı. O, (yəni Mənuçöhr) Nuşirəvan Adilin[1569] nəslindəndir. Fərrux Yəsar zamanında Əbu-Səid Kürəkan Qarabağda qışlaq etmişdi və Fərrux Yəsarın [ona qarşı] müxalifliyi səbəbindən Həsən padşah, Sultan Əbu-Səidə qalib gəlmişdi. [Həmin hadisənin] tarixi bu beytdən aydın olur:

"Əcaib bir lətifədir ki, onun qoşununu,

---

[1565] Bu hadisə Tehran nəşrində naqis şəkildə əksini tapdığı üçün tərcümə zamanı Baroda nəşri və Bakı nüsxəsi əsas götürülmüşdür.
[1566] Bakı nüsxəsi: "İraqda baş verən hadisələr haqqında söhbət".
[1567] Bəvvənat – Fars vilayətində, Məşhədi-Mürğabdan 20 mil şimal-şərqdə yerləşən bir kənddir *(Seddon, şərhlər, s.225)*.
[1568] Nuruosmaniyyə və Bakı nüsxələri: "Yazər"; Baroda nəşri: "Bazər". Bəlkə də, burada Baxərz nəzərdə tutulur.
[1569] Nuşirəvan Adil – Sasani hökmdarı Xosrov Ənuşirəvan (531-579) nəzərdə tutulur. Şirvanşahlar özlərini Sasani nəslindən hesab edirdilər *(S.B.Aşurbəyli. Şirvanşahlar dövləti, s.293)*.

Uzun Həsən vurdu və tarixi “Şirvanşah”dır”[1570].

Qəribə təsadüfdür ki, “Şirvanşah” həm də adı çəkilən şəxsin (Uzun Həsənin) cülus[1571] tarixidir. [Yuxarıda] qeyd edildiyi kimi, [Fərrux Yəsar] bu il Cəbani mövqeyində əzəmətli qazilərin əli ilə öldürüldü. Səltənətinin müddəti otuz yeddi ildir. Ondan sonra oğlu Bəhram bəy padşah oldu və qısa müddət içində öldü. Onun yerinə qardaşı Qazı bəy keçdi. “Qazıbəyi” [adlanan] sikkə ondan qalmışdır.

Əmir Əlişir ibn Əmir Qiyasəddin Kickinə. Onun əcdadları Mirzə Ömərşeyx ibn Əmir Teymurun məxsusları silkində qərar tutmuşdular. Əmir Əlişir uşaqlıq əyyamında həmişə Sultan Hüseyn mirzənin xidmətində vaxtını keçirmişdir. O həzrət Mirzə Əbülqasım Baburun hüzurunda olduğu zaman Əmir Əlişir də Baburun mülazimi idi. Mirzə Baburun vəfatından sonra Sultan Hüseyn mirzə Məşhəddən Mərvə tələsdi. Əmir Əlişir həmin vilayətdə qalaraq fəzilət və kamal öyrənməklə məşğul oldu. Sultan Əbu-Səid zamanında Herata gedib bir neçə gün sultanın xidmətində vaxtını keçirdi. Amma qayğı görmədi. Ona görə də Xorasandan Mavəraünnəhrə tələsdi və Xoca Fəzlulla Əbül-Leysinin xanəgahında məskunlaşıb əksər vaxtını mütaliəyə sərf etdi. Arabir də Mavəraünnəhrin ixtiyar sahibləri olan Əmir Dərviş Məhəmməd Tərxanla və Əmir Əhməd Hacı ilə söhbətləşirdi. Sultan Hüseyn mirzənin istilası üzündən Sultan Əhməd mirzə Xorasanı tərk edib Səmərqəndə yollandığı əyyamda Əmir Əlişir də onunla birlikdə idi. Sultan Hüseyn mirzənin qələbə çaldığı təsdiqləndikdə, [Əmir Əlişir] Əmir Hacıdan icazə alıb Herata yönəldi və bayrama yaxın Sultan Hüseyn mirzə ilə görüşdü. Bayram günü isə “Hilaliyyə” qəsidəsini oxudu. Bu məsələ padşahın ona olan inamının artmasına səbəb oldu. Tədricən onun işi (vəziyyəti) elə bir yerə çatdı ki, Sultan Hüseyn mirzə ona məktub yazardı və onun ləqəblərini bu tərzdə qələmə alardı: “Hidayətin pənahı olan və yüksək fikirlər daşıyan cənab, din və dövlət yiyələrinin ən seçkini, mülk və millət sahiblərinin öndəri, xeyirli işlər görən, yaxşılıq etməyi bacaran, səltənətin sütunu, məmləkətin dayağı, xaqan dövlətinin köməkçisi, sultan həzrətlərinin yaxını, haqqın, həqiqətin və dinin nizamı Əmir Əlişir, Allah onun müvəffəqiyyətini artırsın!”.

Nəql edirlər ki, [bir dəfə] Xoca Məcdəddin, Sultan Hüseyn mirzəyə ziyafət vermiş və ona çoxlu peşkəş çəkmişdi. Hərçənd o zaman tazikə[1572] çaharqəb vermək adəti yox idi, amma xoşagələn xidmətinə görə [Xoca Məcdəddin] bu şərəfli mükafata layiq görüldü. Cağatayların adəti üzrə o, [çaharqəbi geyərək] doqquz yerdə dizini yerə vurdu. Bir saat keçdikdən sonra yenə həmin məclisdə Əmir Əlişir özünün on bir təngə və iki miri dəyərindəki xirqəsini xoca üçün göndərdi. Xoca onu padşahın çaharqəbinin üzərindən geydi. [Xirqə] onun dizinə çatmasa da, Əmir [Əlişir] üçün də doqquz yerdə diz vurdu.

Bu il Sultan Hüseyn mirzə Astarabaddan dönərkən Əmir Əlişir onu qarşılamağa tələsdi. Padşahın kəcavəsinin yaxınlığına çatanda Xoca Şihabəddin Abdulla qabağa çıxdı. Əmir Əlişir onu qucaqlayıb əhvalını soruşdu. Lakin sözünü bitirməmiş onda hal dəyişkənliyi peyda oldu. Son dərəcə iztirabla dedi ki, xoca, mənim halımdan qafil olma! O, bu sözü deyən vaxt Sultan Hüseyn mirzənin kəcavəsi yaxınlaşdı. Əmir Əlişir atdan aşağı endi ki, irəli getsin və padşahla görüşsün. Onun ayaqlarında qüvvət qalmamışdı. O, bir əlini Xoca Abdullanın çiyninə və digər əlini Mövlana Cəmaləddin Qasım Xandəmirin çiyninə qoyub özünü kəcavənin yanına çatdırdı və [padşahın] feyz bəxş edən barmaqlarını öpməyə təşəbbüs göstərib, zəifliyinin şiddətindən həmin yerdə oturdu. Padşah hərçənd ona müraciət edərək əhvalını soruşsa da, cavab verə bilmədi. Padşah buyurdu ki, onu yedək kəcavəyə yatırıb həmin gecə şəhərə çatdırsınlar. O zaman onda iflic əlaməti göründü. Bir saat sonra ondan qan aldılar. [Lakin] beş-altı damcıdan artıq qan axmadı və cümə gününün gecə yarısı onu mənzilinə çatdırdılar. Səhər çağı bütün təbiblər toplaşıb bir daha ondan qan alsalar da, faydası olmadı. Yekşənbə günü fani dünyadan əbədiyyət aləminə köçdü. Onun [vəfat] hadisəsinin tarixi haqqında demişlər:

Beyt

“Beş hərf dedi və oldu təslim,
Əlif, bey, tey, sey və cim”[1573].

Əsərləri sırasında bunlar vardır: “Divani-türki” (“Türkcə divan”), “Xəmsə” (“Beşlik”), yenə də türkcə “Məcalisün-nəfais” (“Nəfisliklərin məclisləri”), “Töhfətül-müluk” (“Hökmdarlar töhfəsi”), “Divani-farsi”

[1570] “Şirvanşah” = 873 (1468-69).
[1571] Cülus – padşahın taxtda oturaraq hökmdarlığa başlaması nəzərdə tutulur.
[1572] Tazik – tacik deməkdir.
[1573] Bu hərflərin əbcəd hesabı ilə cəmi 906-ya bərabərdir və bu, hicri tarixlə Əlişir Nəvainin ölüm ilidir.

(“Farsca divan”), “Məhbubül-qülub” (“Qəlblərin sevgilisi”), “Halati-Pəhləvan Məhəmməd Əbu-Səid” (“Pəhləvan Məhəmməd Əbu-Səidin əhvalatları”), “Xeyrül-əbrar” (“Nəciblərin xeyri”), “Fərhad və Şirin”, “Səddi-Skəndəri” (“İsgəndər səddi”), “Leyli və Məcnun”, “Münşəati-türki” (“Türkcə məktublar”), müəmma fənni haqqında “Müfrədat”, “Əruzi-türki” (“Türk əruzu” və ya “Türkcə əruz”), “Halati-Seyid Həsən Ərdəşir” (“Seyid Həsən Ərdəşirin əhvalatları”), “Xəmsətül-mütəhəyyirin” (“Heyrətə düşmüşlərin beşliyi”), “Nəsaimül-məhəbbət” (“Məhəbbət mehləri”).

O, üç yüz yetmiş xeyriyyə binasını, o cümlədən doxsan ribatı təmir etdirmişdir. Çox zalım və xarici[1574] olmasına baxmayaraq, incə zövqlü idi.

## 907-Cİ İLİN (17.07.1501 – 06.07.1502) HADİSƏLƏRİ HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın Əlvənd Türkmanla müharibə etməsi

İsgəndər şanlı xaqan Gülüstan qalası ətrafında olduğu zaman Əmirzadə Əlvəndin vəziyyətini öyrənmək üçün Qarabağa getmiş Şeyx Məhəmməd xəlifənin yanından bir qasid gəlib ərz etdi ki, Əmirzadə Əlvənd çoxlu ordu və saysız məiyyətlə savaş və döyüş əzmi ilə Təbrizdən Naxçıvana gəlmişdir və Mahmud Qaracanı türkman qoşununun bir dəstəsi ilə birlikdə Gəncəyə tərəf göndərmişdir ki, Qoyun-ölümündən keçib Şirvan vilayətinə daxil olsun.

Elə ki İsgəndər şanlı xaqan müxaliflərin hiyləsindən agah oldu, Gülüstan camaatının günahlarının üstündən keçib Azərbaycana yollandı. İtaəti vacib olan fərmana əsasən, Cövşən mirzəyə[1575] körpü qurmaq əmr edildi və o, oraya tələsdi. O həzrət Cavadda[1576] təkmil edilən körpüdən keçib o ətrafda cah-calalla dayandı. O əsnada [İsmayıla] ərz etdilər ki, Həsən bəy Şüküroğlu müxaliflərin bir dəstəsi ilə Qaracadağa gəlib zülm və zorakılıq qapılarını o vilayətin rəiyyətinin üzünə açmışdır. Qəzavü-qədər kimi cərəyan edən bir fərman verildi ki, həmin mənzildən Piri bəy Qacar təkəlü qazilərindən [ibarət] bir dəstə ilə onları dəf etməyə getsin. Piri bəy Qaracadağ tərəfə sürətli yürüş etdi. Şüküroğlu fərar edib Naxçıvanda Əlvəndə qoşuldu. Piri bəy çoxlu mallar və saysız qənimətlər ələ keçirib Baboğluda[1577] hökmdar ordusuna qoşuldu. Bu mənzildə məlum oldu ki, Məhəmməd Qarçığay bu çevrədə qol-qanad açaraq bu ətrafda və yan-yörədə bir ov ələ keçirmək ümidi ilə bir tələ qurmuşdur. Ona görə də hökmdar bayrağının hümay quşu uğur qanadını açıb döyüş səhrası fəzasının havasında pərvazlandı. Qarçığay Məhəmməd qartaldan qorxan göyərçin kimi min cür çarəsizlik və iztirabla idbar qədəmini fərar vadisinə qoyub Naxçıvandakı bəxtsiz məiyyətə qoşuldu. Onların fərar etməsindən sonra qələbə nişanlı bayraqlar Qaraağac ətrafındakı Sultanpur[1578] yolundan Naxçıvana yönəldilər. O əsnada Osman Mosullu bir dəstə Ağqoyunlu dilavəri ilə göründü. Qələbə şüarlı əsgərlərdən Piri bəy Qacar və Halvaçıoğlu Əmiri-şikar[1579] iqtidarlı dövlətin qazilərindən [ibarət] bir dəstə ilə İlahiyə səcdələr etdikdən və şah həzrətlərindən himmət dilədikdən sonra xidmətkarlıq meydanında fədakarlıq etmək ümidi ilə qədəmlərini irəli qoydular. Əmir Osman özünə həmdəm olan quldurlar dəstəsi ilə qarşıdurma və vuruşma addımı ilə qabağa gəldi. Çox çətin bir müharibə baş verdi. Bəla oxu qəzavü-qədərin əlindən açıldı. Hər tərəfdə bir çoxları həlak torpağı üzərinə düşdülər. Aləmi yandıran nizənin şimşəyi sabitik xırmanına ölüm şöləsi saldı. Atəş saçan oxun ucu əmin-amanlıq və salamatlıq sözlərini ruzigarın vərəqlərindən sildi.

“Günəş kirşəli kamanlardan atılan oxlar,
Öz dişləri ilə zirehə düyün vurmuş.

---

[1574] Xarici – islamda radikal bir cərəyan. Həzrət Əli bu cərəyanın nümayəndəsi tərəfindən öldürülmüşdür. Səfəvi mənbələri bir sıra hallarda qatı sünniləri “xarici” adlandırırlar. Yəqin ki, burada da həmin ifadə Nəvainin sünni olduğunu bildirmək üçün sünni sözünün sinonimi kimi işlədilmişdir.

[1575] Nuruosmaniyyə nüsxəsi: “Cuş mirzəyə”.

[1576] Cavad – Azərbaycanda, Kür və Araz çaylarının qovşağında yerləşən tarixi şəhər.

[1577] Baroda nəşri: “Ərbaboğlu”; Məclis nüsxəsi: “Baba-Ərkli”; Bakı nüsxəsi: “Babi-Dürəli”. Bizcə, burada Füzuli rayonu ərazisindəki Babı kəndi və Arğalı türbəsi nəzərdə tutulur.

[1578] Bakı nüsxəsi: “Sultan”. Qaraağac mahalı indiki Ağdam və Ağcabədi rayonları ərazusində yerləşirdi. O dövrdə məşhur bir qışlaq olan Sultanbud qışlağı da bu mahala daxil idi. Ola bilsin ki, burada Sultanpur deyil, Sultanbud yazılmalıdır.

[1579] Əmiri-şikar (mirşikar) – şahın ov işini təşkil edən məmurlar. Mirşikarlara ümumi rəhbərlik mirşikarbaşı və ya ovçubaşı adlanan vəzifəli şəxs tərəfindən həyata keçirilirdi *(О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.265; G.Şükürov. Safevîlerde av geleneğinin oluşumu ve I. Şah İsmail dönemi av merasimleri // Acta Turcica, yıl: 1, sayı: 1, Ocak 2009, s.57-58).*

Savaş ərlərinə yetərincə ox batdığı üçün,
Nəhənglərin hər biri xədəng ağacına dönmüş".

Nəhayət, qələbə və üstünlük mehi təriqətpərvərlik yolunun yolçularının bayrağının pərçiminə əsdi. Müxaliflər döyüş meydanından qaçış vadisinə tələsdilər. Bəhram [kimi] hiddətli ordu qüdrət pəncəsi ilə o səadətsiz qövmün əksərini izzət atından zillət torpağına saldı. Zəfər şüarlı əsgərlər çoxlu qənimətlərlə hökmdarın ordugahına qayıtdılar. Osman Mosullunu və onun yoldaşlarını aləmin pənahı olan dərgaha gətirdilər. Əcəmin və ərəbin padşahı olan qəzəbli qəhrəman (İsmayıl) onların qətlinə fərman verdi.

Bu məğlubiyyət xəbəri Əmirzadə Əlvəndə bəlli olduqdan sonra o, ağacların yarpaqları kimi çox və yağış damlaları qədər saysız olan, daş ürəkli və polad geyimli dağa bənzər ordu ilə sürətli sel kimi gurultu və hay-küylə Çuxursəədə yönəldi və Şərur mövqeyində qərar tutdu. Yaxşı silahlanmış otuz min süvari ilə zəfər şüarlı xaqana qarşı müharibəyə könül verdi. Bu tərəfdən də xaqan həzrətləri Allahın köməyi ilə əksəri zirehsiz olan yeddi min süvari ilə müxaliflərin qarşısına çıxdı. Cəsarətlə dolu olan xaqan, zəfər sahibi ("Əbülmüzəffər") Şah İsmayıl Bahadır xan yanlış yolun yolçularına qarşı döyüş və vuruş işlərini tərtib etməkdən ötrü öz misilsiz bədəninə İlahi himayə cövşənini geyindi.

Nəzm

"Qullarının ağası olan şahın bədənindəki zireh,
Nurla doludur, günəşin çeşməsi kimi.
O nihandır cövşənin altında yüz rövnəq və qüvvətlə,
Dənizin dalğaları içindəki timsah kimi".

[İsmayıl] sonsuz yardım atına minib, zəfərin əta edildiyi ordunun hazırlanması üçün lazım olan işləri dəqiqliklə yerinə yetirdi. O, qələbə şüarlı qoşunun sağ və sol cinahlarını Hüseyn bəy Lələ, Abdal bəy Dədə[1580], Bayram[1581] bəy Qaramanlu, Xüləfa bəy *Talış*[1582], Məhəmməd bəy Ustaclu[1583], Əbdi bəy Şamlu, Qaraca İlyas Bayburtlu, Piri bəy Qacar və Sarı Əli Möhürdar kimi adlı-sanlı əmirlərin vücudu ilə möhkəmləndirdi.

Şeir

"Fələk şövkətli Əlvəndin o biri tərəfində,
Əlvənd dağı kimi bir səf düzəltdi".

O tərəfdən Əmirzadə Əlvənd də öz yaramaz qoşunlarını tərtib etməklə məşğul oldu. Onun buyruğuna əsasən, ordunun dəvələrinin hamısını toplayıb, zəncirlə bir-birinə bağlayaraq qoşunun arxasında saxladılar ki, döyüş meydanından qaçış vadisinə tələsən hər kəs üçün kənara çıxmağın yolu bağlı olsun. Ondan sonra ad-san arzusunda olanlar kin meydanına çapıb yeri-göyü lərzəyə saldılar və işıq saçan günəş tozanağın şiddətindən zülmət niqabını örtdü.

Nəzm

"Döyüş meydanından qalxan tozdan,
Adamların gözündə cahan qaraldı.
O tozanaqda günəş elə itdi ki,
Asiman onu yüz çıraqla axtardı".

Hərb dənizinin dalğaları təlatümə gəldi. Bir çoxlarının ömür gəmisi ölüm girdabına qərq oldu. Qan seli Ceyhun çayı kimi çöl və biyabanın üzərində axmağa başladı.

Nəzm

"Dərə və çöl qan selindən sulandı,
Orada minik heyvanları üzməyə başladılar.
Cəngavərlərin mübarizəsi uzandı,
O ipin düyünləri açılmaz oldu.
Amma axırda uca asiman,

---

[1580] Tehran nəşrində səhvən "Abdal bəy Lələ" yazılmışdır.
[1581] Bakı nüsxəsində səhvən "Bürhan" yazılmışdır.
[1582] Bakı nüsxəsi (33a).
[1583] Tehran nəşri və Bakı nüsxəsi: "Məhəmmədi bəy Ustaclu".

Əlvəndlilərə yetirdi bəla.
O dəmir sədd dağıldı,
Onların qüvvəsi alt-üst oldu".

Leysan damlalarını və ağacların yarpaqlarını xatırladan belə bir əzəmətli qoşun və saysız-hesabsız ordu payız yarpaqları və nisan yağışı kimi az adam qarşısında dağılıb pərakəndə oldu.

Şeir

"Əlvəndi yerindən qopardılar,
Dəmavənd dağını yıxdılar".

Əmirzadə Əlvəndin böyük əmirlərindən Lətif bəy, Seydi[1584] Qazı bəy, Musa bəy və Məhəmməd Qarçığay qətlə yetirildilər. Əlvənd döyüş meydanından Ərzincan tərəfə qaçdı. Ağqoyunlu qövmünün həyat günəşi zaval sərhədinə yetişdiyindən, o vurhavurdan qaçanlar dəvələrin səfinə çatanda qurtuluş yolunu bağlı gördülər və zəfər şüarlı ordu arxadan gəlib onları dəvələrlə birlikdə ox yağışına tutdular.

Şeir

"Dəvəyə o qədər ox sancıldı ki,
O, oxların lələklərindən dəvəquşuya oxşadı".

Özünü yoxluq burulğanından xilas sahilinə salmış bir dəstə isə yol əsnasında elə bir bataqlığa çatdı ki, atını oraya sürən hər kəsin həyat gəmisi yoxluq girdabına düşüb əlini canından üzdü. Əlvəndin və onun əsgərlərinin yaraqlarından və mallarından qazilərin əlinə o qədər qənimət düşdü ki, onun onda birinin onda biri (yəni 1 %-i) belə heç bir müstəqil padşahın xəyal xəzinəsinə sığışmazdı.

İsgəndər şanlı xaqan düşmənlər tərəfdən xatircəm olduqdan sonra o mənzildə (məkanda) qalıb ertəsi gün hərəkət bayrağını darüssəltənə Təbrizə doğru yüksəltdi. O şəhərin seyidləri və böyükləri onu səadət və uğur [nişanəsi] kimi qarşılayıb onun feyz verən barmaqlarını öpmək şərəfi ilə iftixarlı və başı uca oldular, niyaz (dua) etmək və qurban kəsmək mərasimini yerinə yetirdilər. O həzrət səltənət taxtının yerləşdiyi məkan və yüksək şanlı padşahların xilafət dairəsinin mərkəzi olan darüssəltənə Təbrizdə son dərəcə əzəmətlə qərar tutdu. O, ədalət və mərhəmət günəşinin şüaları ilə o vilayətin sakinlərini zülm zülmətindən azad etdi və rəiyyətin hamisi olub, başsız qalmış türkmanların kamanına ruzigarın qoyduğu hadisələr oxunun bəlasından biçarə rəiyyətə nicat verdi.

Nəzm

"Ədalət verən o adilin insafından,
Qurtuldu yaşlı qurddan çöl və kənd.
Cahanda elə bir ədalət əmələ gətirdi ki,
Temmuz (iyul) da Qoç bürcü kimi mötədil oldu.
Heç kimin dilə gətirmək üçün bir arzusu olmadı,
Nə tələbənin, nə yaşlının qələmində bir dilək qalmadı.
Rəiyyət insafından abad oldu,
Bəxşişindən ordusunun hamısı şad oldu.
O düzlükdən əyrilərdə can qalmadı,
Hətta cananın qaşında da bir əyrilik qalmadı".

Həmçinin hakimiyyətinin başlanğıcında (cülusunun əvvəllərində) əmr etdi ki, məmləkətlərin xətibləri on iki imamın – ulu məlik olan Allahın salamı olsun onlara – adına xütbə oxusunlar. 528 il öncə Sultan Toğrul bəy ibn Mikayıl ibn Səlcuqun gəlişindən və Bəsasirinin qaçışından[1585] etibarən islam ölkələrində qadağan olunmuş "Əşhədü ənnə Əliyyən-vəliyyullah" ("Şəhadət edirəm ki, Əli Allahın dostudur") və "Həyyə əla xeyril-əməl" ("Əməllərin ən yaxşısına – namaza – tələsin!") [ifadələrinin] azana əlavə edilib deyilməsini

---

[1584] Baroda nəşri: "Seyid".

[1585] Bəsasiri – tam adı Əbül-Haris Arslan Bəsasiridir. XI əsrdə yaşamış türk sərkərdəsidir. O, h. 450-ci ilin zilqədə ayının 8-də (27.12.1058) Bağdadı tutaraq orada şiə xütbəsi oxutdurmuşdu. Lakin bir il sonra Toğrul bəy Səlcuqinin gəlişi üzündən Bağdadı tərk etmiş, Səlcuqilərlə döyüşdə öldürülmüş və başı kəsilərək h. 451-ci ilin zilhiccə ayının ortalarında (1060-cı ilin yanvar ayında) Bağdadda gəzdirilmişdi *(Ə.Nəvai. Şərhlər, s.977).* Həsən by Rumlu h.451-ci ildə baş vermiş bu hadisə barəsində "528 il öncə" yazarkən, yəqin ki, Şah İsmayılın hakimiyyətə gəlişindən öncəni deyil, bu sətirlərin qələmə alınmasından öncəki zamanı nəzərdə tutmuşdur. Bakı nüsxəsində natamam şəkildə "520 il" yazılmışdır.

də əmr etdi. Hökmdar fərman verdi ki, bazarlarda Əbu-Bəkrə, Ömərə və Osmana tənə və lənət edilsin və buna qarşı çıxan hər kəsin başını bədənindən ayırsınlar.

O zaman camaatın haqq olan Cəfəri məzhəbinin məsələlərindən və on iki imam ("əimmeyi-isna-əşəri") tərəfdarlarının qayda-qanunlarından məlumatı yox idi. Çünki imamiyyə fiqhinin[1586] kitablarından ortada bir şey yox idi. Ona görə də dərin bilikli alimlərin sultanı Şeyx Cəmaləddin Mütəhhər Hillinin[1587] əsərləri cümləsindən olan və şəriətin pənahı Qazı Nəsrulla Zeytuninin[1588] [şəxsi kitabxanasına] məxsus olan "Qəvaidi-islam" ("İslam qaydaları") kitabının birinci cildini dini məsələlərin təlimi və öyrədilməsi üçün istifadə etdilər. Nəhayət, on iki imam (isna-əşəri) məzhəbinin həqiqət günəşi günbəgün yüksəldi, aləmin ətrafı və yan-yörəsi onun məşriqindən doğan doğruluq yolunun parlaq şüaları ilə nurlandı.

### Müxtəlif əhvalatlar

Bu il Sultan Murad Şiraza yönəldi. Onun hərəkətindən xəbər tutan Qasım bəy Pornak Fars camaatı ilə onu qarşılamağa tələsdi. Sözügedən ilin səfər [ayının] 17-də (01.09.1501) Qasım bəyi tutub onun ordusunu tarac etdilər və Qasım bəyin mallarının zəbt edilməsi üçün Əmir Məhəmməd Sabiqini Şiraza göndərdilər. Sultan Murad Kazerunda qışlaq edib ramazanda (10.03-08.04.1502) İraqa yollandı və Fars hakimliyini Aybə sultanın qardaşı Yaqubcan bəy Bayandura həvalə etdi. Qasım bəyi İstəxr qalasına apardılar. Bir müddət sonra onu İsfahan qalasına köçürdülər. Orada Nurəli bəy Pornakın oğlu Yarəli bəy onu qətlə yetirdi.

Bu il hər biri istiqlal iddiasına malik olan neçə-neçə hakim İran vilayətində "mənəm və başqası yoxdur" deyə bayraq qaldırmışdılar. Bu şəkildə: İsgəndər şanlı xaqan – Azərbaycanda; Sultan Murad – İraqın əksər yerlərində; Murad bəy Bayandur – Yəzddə; Rəis Məhəmməd Kərrə[1589] - Əbərquhda; Hüseyn Kiya Çəlavi – Simnanda, Xəvarda və Firuzkuhda; Əli bəyin oğlu Barik bəy Pornak – İraqi-Ərəbdə; Qasım bəy ibn Cahangir bəy ibn Əli bəy – Diyarbəkrdə; Qazı Məhəmmədlə Mövlana Məsud Bidgüli – Kaşanda; Sultan Hüseyn mirzə – Xorasanda; Əmir Zünnun – Qəndəharda; Bədiüzzaman mirzə – Bəlxdə; Əbülfəth bəy Bayandur – Kirmanda.

### Ölümlər

Bu il Sultan Əbu-Səidin oğlu Mirzə Uluğ bəy öldü. Oğlu Mirzə Əbdürrəzzaq onun yerinə keçdi.

Həmçinin bu il Mövlana Şərəfəddin Əli Şiftəgi öldü. O, Mövlana Möhyəddinin və Mövlana Qivaməddin Gülbarinin yanında elmlər barədə təhsil almışdı. Onun əsərləri sırasında bunlar vardır: "Təfsiri-ayati-ehkam" ("Ehkam ayələrinin təfsiri"), "Şərhi-mühərrər" ("Yazılmış şərh") və "Şərhi-irşad" ("İrşadın şərhi").

Həmçinin bu il Sultan Hüseyn mirzənin oğlu Məhəmməd Məsum mirzə Qaində qaraciyər ishalından əbədi aləmə köçdü.

## 908-Cİ İLDƏ (07.07.1502 – 25.06.1503) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Əlvəndin Ərzincandan Azərbaycan tərəfə gəlməsi haqqında

Bu il xəbər gəldi ki, Əmirzadə Əlvənd yenidən Ərzincandan bir ordu toplayıb, qeyri-mümkün istiqlal xəyalı ilə hərb və döyüş ləvazimatını hazırlamşdır. Ona görə də düşənbə günü, şəvval [ayının] 24-də (02.05.1502)[1590] yaxşı əməlli hökmdar mübarək tale və xoşbəxtliklə, uğurun və bəxtiyarlığın köməyi ilə səadət və iqbal üzünü, əzəmət və cah-calal simasını din və dövlət müxaliflərini dəf etməyə yönəltdi. Həmin ilin mübarək zilhiccə ayının 11-nə (17.06.1502) kimi Aladağ yaylağının bütün məsafələrini ov edə-edə qət etdilər və Tərcan yaxınlığındakı Ləkzi çəmənində cah-calalla dayandılar. Bundan xəbər tutduqdan və şahın bargah çadırını gördükdən sonra müxalif ordusu yarasalar kimi tamamilə pərən-pərən düşüb, böyük dəhşət içində xof ayağını fərar atının üzəngisinə qoydular və hərəkət yüyənini çarəsizlik əlinə verib, idbar və pərişanlıq

[1586] Fiqh – şəriət hüququ.
[1587] 1250-1325-ci illərdə yaşamış şiə ilahiyyatçısı.
[1588] Məclis nüsxəsi: "Rənbuninin".
[1589] Bakı nüsxəsi: "Məhəmməd Dərviş Kürə".
[1590] Burada 907-ci ilin şəvval ayından söhbət gedir.

üzünü qaçış və hicran səmtinə tutdular. Düşənbə günü, [ayın] 21-də (27.06.1502)[1591] [qızılbaşlar] Ləkzi çəmənindən köç edib zöhr (günorta) vaxtı Dərunə-kuhi yaxınlığındakı Qoç-Əhmər yurduna yetişdilər.

O əsnada ətrafda və yan-yörədə əzəmətli qoşunun qüdrət əli və üstün bəxti ilə əsir edilən qalib dövlətin bir sıra müxalifləri qətlə yetirildilər. Müzəffər əsgərlər sözügedən yurdun bütün yaşıl çəmənini, dağını və təpəsini göz görə bildiyi qədər kağız kimi [ağ rəngli] çadırların qurulması ilə bahar çiçəyitək ağ rəngə boyadıqdan və səyyarələr sultanı, yəni qızıl saçan günəş gündüz qövsünün bütün məsafələrini qət edib, Ağqoyunlu türkmanlarının dövlət günəşi kimi qüruba getdikdən sonra xəbər çatdı ki, yaramaz Əlvənd və onun ətrafına toplanmış dağınıq dəstə Ərzincandakı Sarıqaya[1592] ətrafına sığınmışlar. Xaqan həzrətləri İlahi yardımla iqtidar sahibi olan əksər adlı-sanlı əmirlərlə və qələbə nişanlı qazilərlə birlikdə kükrəyən aslan kimi coşub-gurlayaraq, cah-calal ayağını uğur atının üzəngisinə basıb, səba yeli kimi tam sürətlə onlarn ardınca yürüş ("ilğar") etdi. Axşamdan səhərəcən iyirmi fərsəx yol gedib müxaliflərin yurduna çatdılar. Onlar son dərəcə qorxu və təşviş ucbatından öz yüklərini ("ağruq"larını) atıb getmişdilər. Qazilər o qənimətləri ələ keçirdilər. Əlvəndin Təbrizə getdiyini eşidən İsgəndər şanlı xaqan köhlən atının yüyənini Azərbaycan tərəfə çevirib çapdı. Makudan[1593] sürətlə keçib Təbrizə çatdı. Əlvənd Türkman kamandan atılan ox kimi Azərbaycan məmləkətindən çıxıb Bağdada üz tutdu. Xaqan həzrətləri səadət və uğurla Ucana çatdı. Qazilər müxaliflərin son dərəcə tələskənlik üzündən atıb getdikləri yükləri və malları ələ keçirib, Təbrizə yollanaraq orada qışlaq etdilər.

### İsgəndər şanlı xaqanın Sultan Muradla müharibə etməsi haqqında söhbət

O zaman ki Azərbaycan məmləkəti İsgəndər şanlı xaqanın əlinə keçdi, Yaqub padşahın oğlu Sultan Murad iztiraba düşüb, "dostluq və düşmənlik miras olaraq keçər" hədisinin məzmununu yada salaraq ətrafa və yan-yörəyə adam göndərdi, öz əsgərlərini cəmləşdirdi. Qılıncdan qurtulub müxtəlif yerlərə səpələnmiş Ağqoyunlular toplaşdılar. O, İraqdan təxminən beş min piyada tələb etdi və qışın əvvəllərində təqribən yetmiş min nəfər cövşən geyən, xəncər vuran süvari ilə Dilican[1594] kəndindən Həmədana doğru hərəkət bayrağını yüksəltdi. Öz anası Gövhər-sultanı Quma göndərdi[1595] ki, İslamış[1596] bəyi ordu ilə birlikdə dərgaha gətirsin. Gövhər-sultan xanım İslamış bəyə dedi:

- Qızılbaş qoşunu və alçaq dilavərlər bu diyara gəlməkdədirlər. Eşitmiş olarsan ki, atam şirvanşahı və b. yüksək məqamlı padşahları necə məğlub etmişlər. Əgər bizə yardım göstərməkdə laqeydlik etsən, onlar güclü ordu ilə hiddət və kin üzündən bu diyara gəlib Sultan Muradı məğlub edəcəklər və türkmanların arvad-uşaqlarını əsir götürəcəklər. Öz uşaqlarınıza rəhminiz gəlsin.

Ona görə də İslamış bəy çoxlu ordu ilə savaşa yollanıb, Qumdan çıxaraq hərəkət bayrağını Sultan Muradın düşərgəsinə doğru yüksəltdi və Mənsur bəy Pornakın zaviyəsinə çatdı. [Daha sonra] köçhaköçlə Sultan Muradın ordusuna yollandı.

Sultan Muradın istiqlal kosunun təntənəsi, şövkətinin və iqbalının bolluğu ardıcıl surətdə Azərbaycana çatdığı üçün İsgəndər şanlı xaqan, Sultan Heydərin qulamlarından olan, rəvan danışığı və fəsahətli nitqi ilə tay-tuşlarından seçilən və üstün olan Qənbər ağa adlı elçini Sultan Muradın yanına göndərdi ki, onu itaətə və tabeçiliyə dəvət etsin.

Nəzm

"Ağlı iti, zirək və bacarıqlı,
Yaxşı danışan, çox bilən müdrik.
Mey satanın küpü kimi əndişə dolu[1597],
Onun içi coşduğundan bayıra daşmış"[1598].

---

[1591] Baroda və Tehran nəşrlərində Şah İsmayılın Ləkzi çəməninə gəlişi 21 zilhiccəyə, oradan ayrılması isə 11 zilhiccəyə aid edilmişdir. Bu xüsus həmin nəşrlərdə istifadə edilmiş nüsxələrin naqisliyi ilə əlaqədardır. Biz Bakı nüsxəsinin 35b vərəqinə əsasən, gerçək xronologiyanı bərpa etməyə nail olduq.

[1592] Baroda nəşrində Sarıqaya əvəzinə səhvən "Sarıqübbə" yazılmışdır.

[1593] Baroda nəşrində "Maku" əvəzinə səhvən "Bakı" yazılmışdır.

[1594] Baroda nəşrində səhvən "Vəlican" yazılıb. Dilican (Delican) – Kaşandan qərbdə yerləşir.

[1595] Məclis nüsxəsi: "Öz anası olan Fərrux Yəsar Şirvaninin qızı Gövhərşad bəyimi Quma göndərdi". Həqiqətən də, bu qadın Fərrux Yəsarın qızı idi *(S.Aşurbəyli. Şirvanşahlar dövləti, s.316).*

[1596] Bakı nüsxəsi: "Əsləməs".

[1597] Nuruosmaniyyə və Bodleian nüsxələri: "Əndişə dolu olsa da, mey küpü kimi sakitdir".

Qənbər İraq hakimindən pərişan cavablar eşitdi və inadkarlıq, dikbaşlıq əlamətləri müşahidə etdi. O, ali taxtın ətəyinə qayıtdı və görüb-eşitdiyini ərz etdi. Ona görə də cahan məmləkətlərinin sultanı[1599], qalibiyyət sahibi ("Əbülmüzəffər") Şah İsmayıl Bahadır xan – Allah onun mülkünü və səltənətini əbədi etsin – zəfər nişanlı bayraqlarını İraq tərəfə yüksəltdi[1600].

Nəzm

"Kəhər atın üzəngisinə ayağını qoydu,
Sanki uca göyə Məsih yüksəldi.
Doğru rəy və dürüst sidq ilə,
Çevik bir şəkildə yola düşdü".

Səadətə və uğura yaxın olan qələbə məfhumlu bayraqlar Qızıl-üzəndən keçib, mənzilləri və mərhələləri qət edərək Həmədanın Alma-qulağı[1601] [adlı yerində] cah-calalla dayandılar. Sultan Murad ali mənşəli xaqanın yaxınlaşmasından xəbər tutdu.

Nəzm

"Çün bu hadisədən agah oldu Namurad[1602],
Qeyrət atəşi düşdü onun təbiətinə.
Oynadı yerindən təntənə və şövkətlə,
Elə bir şövkətlə ki, ondan suya döndü dağın qılıncı".

O, mühəndislərin təxminindən daha artıq sayda olan ucsuz-bucaqsız bir ordu ilə savaş meydanına yönəlib o həzrətin qarşısına çıxdı. O gecə hər iki qoşun hərb və döyüş ləvazimatını hazırlamaqla və xəncər vuran ərlərin könlünü almaqla məşğul oldu. Sübh çağı ağ bayraqlı Cəmşid, yəni ulduzların padşahı olan günəş savaş əzmi ilə zəfər nişanlı zərnigar cövşənini geyindi, dövr edən asimanın meydanına qədəm qoydu və gündüzün ordusu gecənin zülmət qoşununu məğlubiyyətə uğratdı.

Nəzm

"Sübh çağı səmanın şahı təntənəli surətdə,
Çıxdı bu dünyanın başına iti addımlarla.
Nurdan dəm vurdu sadiq və şövkətli sübh,
Musanın təcəllası peyda oldu dağdan".

Həmin vaxt İsgəndər şanlı xaqan sürətinin yüksəkliyi baxımından keçmiş günləri qabaqlayan və yüyəni dartılan vaxt gələcək zamanı dərhal qavrayan külək rəftarlı atına mindi.

Nəzm

"Aydın şimşək kimi tez yüyürən,
Ulduz bürcü kimi parlayan.
Tullanmaqda ildırım kimi, getməkdə külək kimi,
Sanki ildırımdan və küləkdən doğulmuş".

Və zəfərə öyrəşmiş qoşunlarını tərtib etməklə məşğul oldu. O gün kama çatmış hökmdarın bayraqlarının kölgəsində yaxşı yaraqlanmış on iki min nizədar süvari vardı.

Şeir

"On iki min cəsur pəhləvan,
Pələng yıxan və aslan pəncəli.
Hamısı qranit[1603] yaran qılınc sahibi,
Hamısı xilaf əhlinin canının düşməni".

---

[1598] Məclis və Bakı nüsxələrində son beyt aşağıdakı kimidir: "Mey küpü kimi əndişə dolu və coşqun; Onun içi gurultu ilə bayıra daşmış".

[1599] Baroda nəşri və Nuruosmaniyyə nüsxəsi: "can mülkünün sultanı, aləmin və aləm sakinlərinin xaqanı". Bakı nüsxəsi: "cahan məmləkətlərinin sultanı, aləmin və aləm sakinlərinin xaqanı".

[1600] Baroda nəşrində və Bakı nüsxəsində artıq bir beyt vardır: "Kəyan tacının və taxtının qaşı, Kavilərin ulduzunu parladan".

[1601] Bakı nüsxəsi: "Alma-bulağı". İranın yaşayış məntəqələrinin rəsmi siyahısında bu yer Almaqulağ kimi qeydə alınıb və Bicara bağlıdır *(Nəvai, şərhlər, s.983)*.

[1602] Şah İsmayıl öz rəqibi olan dayısı oğlu Ağqoyunlu Sultan Muradı "Namurad" adlandırırdı *(Nəvai, şərhlər, s.983,985)*.

[1603] Baroda nəşri: "dərya".

O həzrət Xüləfa bəylə Mənsur bəy Qıpçağini çərxçi [təyin] edib, Piri bəy Qacarı min beş yüz süvari[1604] ilə ehtiyatda saxladı. Abdal bəy Dədə, Hüseyn bəy Lələ, Məhəmməd bəy Ustaclu, Bayram bəy Qaramanlu, Əbdi bəy Şamlu, Yegan bəy Təkəlü və Sarı Əli Möhürdar kimi digər əmirlərin bəzilərini sağ cinaha, bəzilərini isə sol cinaha göndərdi və özü nəfis vücudu ilə qələbəyə öyrəşmiş qoşunun mərkəzində məqam və aram tutdu.

O tərəfdən Sultan Murad da təntənə ilə döyüş meydanına gələrək qoşununu tərtib etməyə başladı. Özü mərkəzdə dayandı. Tanrının himayə etdiyi xaqanın qüdrətindən çox qorxduğu üçün öz qoşununun önündə arabalar yerləşdirib onları taxtalar və zəncirlərlə istehkama çevirdi. O, Əli bəy Türkmana sağ cinahda, Murad bəyə sol cinahda yer verdi, İslamış bəyi isə çərxçi [təyin] etdi. Ondan sonra cövşən geymiş dilavərlər, coşqun və qızğın mübarizlər dalğalanan dəniz kimi cuşa gəlib dəstə-dəstə hərəkətə keçdilər. Onların əsləhəsinin şüasından fələyin gözü qamaşdı və tozanağın qalxmasından günəşin aynası qaraldı.

Nəzm

“Fələyi bürüdü savaşın tozu,
Toz rənginə döndü bu mavi küp (səma).
O tozanaqda kəhkəşan küçəsində,
Qalmadı təzə ayın nalından nişan”.

Hiddət və kinlə dolu o iki padşah düşənbə günü, zilhiccə ayının 24-də (20.06.1503)[1605] bu tərtib və qayda ilə bir-biri ilə qarşılaşdılar. Hər iki tərəfin ordusu iki Əxzər dənizi kimi sərsəri küləkdən təlatümə gəldilər. Zurna və şeypur sədası göyün ən yüksək qatına gedib çatdı.

Şeir

“Ney nəfəsi döndü səmum küləyinə,
Düşmənlərin ürəyi ondan məhv oldu şam kimi”.

Səbir və dözüm mübarizlərin ürəyini tərk etdi və ox quşu kaman yuvasından uçdu.

Şeir

“Kamanlardan ox atılmağa başladı,
Göy qurşağından ildırım açılmağa başladı.
Kinli oxların gəliş-gedişindən,
Havada sanki bir tavan düzəldi ox çubuqlarından”.

Timsaha bənzəyən qılınc cavanların həyatının bünövrəsini zədələdi. Ağır gürz dikbaşların başını tutiya kimi əzdi. Əfi ilana oxşayan nizə savaş meşəsi aslanlarının bədənini çeşmə-çeşmə etdi və hər çeşmənin fəvvarəsindən bir [qan] arxı əmələ gəldi.

Nəzm

“Barmaq oxun yağması ilə can ölkəsini fəth etdi,
Əl qılıncın zərbəsi ilə[1606] vücudun minbərini yıxdı.
Mizrağın dişinin hiddətindən cövşənin ödü cırıldı,
Gürzün zərərinin şiddətindən dəbilqənin başı yarıldı”.

İslamış bəy bir dəstə türkman igidi ilə ardıcıl həmlələr edib, qızılbaş çərxçilərini yerlərindən dəbərdərək mərkəzə sıxışdırdı. Bu zaman döyüş dənizinin nəhəngi Piri bəy Qacar qələbə şüarlı qazilərdən [ibarət] bir dəstə ilə İslamış bəyin üstünə basqın edib onu adamları ilə birlikdə yəhərin üzərindən yerə saldı.

O əsnada İsgəndər şanlı xaqanın əzmkarlıq ildırımı igidlik buludundan parlamağa başladı. O, gurlayan şimşək kimi öz qoşununun mərkəzindən müxaliflərin mərkəzinə həmlə edib qiyamət gününün əlamətlərini zühura gətirdi. O cəsurluq və mərdlik meşəsinin aslanları, qoçaqlıq və misilsizlik dənizinin nəhəngləri həmin döyüş meydanında imkanları yetdiyi qədər vuruşdular və qan tökdülər. Sultan Muradın adamları da ayaqlarını möhkəm dirəyib, cəsurluq əlini pəhləvanlıq qolçağından çıxararaq elə hərb etdilər ki, onun dəhşə-

---

[1604] Bakı nüsxəsi: “min süvari”.

[1605] 20.06.1503 – düşənbə (bazar ertəsi) gününə deyil, seşənbə (çərşəmbə axşamı) gününə təsadüf etmişdir. Tarixçilərin əksəriyyəti bu döyüşü miladi təqvimlə 21.06.1503-cü ilə aid edirlər *(Q.Sərvər. Tarixi-Şah İsmail. Tehran, 1374, s.54; О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.54; R.M.Savory. The Consolidation of Safavid Power in Persia // Der Islam, band 41, Berlin, 1965, p.72; F.Sümer. Safevî Devletinin kuruluşu ve gelişmesinde Anadolu Türklerinin rolü. Ankara, 1999, s.23)*.

[1606] Tehran nəşri: “imanı ilə” (?).

tindən səbir və dözüm yüyəni beşinci hasarın kutvalının iqtidar əlindən çıxdı. Atəş saçan nizənin parıltıları həyat xırmanını şimşək kimi yandırırdı və qan içən oxların ucu bədənin içini ildırım kimi can odlayan şölə ilə alışdırırdı.

Axırda türkman ordusunun əhvalında acızlik və zəiflik əlaməti görünməyə başladı. Namurad başa düşdü ki, iş başqa cürdür və fəthlə qələbə qəzavü-qədər sahibinin yardımına bağlıdır. O, əmirləri ilə birlikdə idbar yüyənini fərar səmtinə çevirdi. Xaqanın müzəffər qoşunları İlahi kömək sayəsində zəfər və qələbə bayraqlarını yüksəldib düşmənləri təqib etdilər, onlardan on min nəfər qətlə yetirdilər. İslamışı və Əli bəyi can odlayan nizə zərbəsi ilə həlak torpağı üzərinə saldılar. Namurad əcəli bir az təxirə düşmüş olan məhdud bir dəstə ilə Şiraz tərəfə qaçdı.

Nəzm

"Bəxti üz döndərmiş sultan yüz hiylə ilə,
O qəm meydanını tərk edib getdi.
Çərxi-fələyin qaydası belədir ki,
Şirin şərbətdən sonra zəhər içirdir.
Fələyin insaf kimi bir adət-ənənəsi yoxdur,
Hər namurada qarşı o, kin bəsləyir".

İsgəndər şanlı xaqan bu şöhrətli qələbənin şükrü üçün Həzrət Pərvərdigara lazımi dualar etdi və döyüş meydanında tabeçilik topunu igidlik çövgəni ilə irəli aparan (əmrləri igidliklə icra edən)[1607] şəxslərə cürbəcür lütflərlə nəvaziş göstərdi. Ali hökm verildi ki, fəthnamələr yazısın. Aydın ürəkli katiblər bu fərmanları mükəmməl surətdə yazdılar. Ali fərmanlar ətrafa və yan-yörəyə göndərildi. [Bu məqsədlə] səba və şimal küləklərinə yoldaş olan uğur müjdəçiləri yola çıxıb ətraf məmləkətlərə getdilər. Taleyin dili bu mövzunu belə tərənnüm etdi:

Nəzm

"Oturdu yer üzünün şahı haqlı surətdə,
Sultanların taxtının üzərində İraq darülmülkündə".

Ondan sonra Həmədan çəmənində cah-calalla dayandılar.

### Fars vilayətində baş vermiş hadisələr haqqında söhbət

Şənbə günü, sözügedən ilin səfər [ayının] 3-də (08.08.1502)[1608] Hacı bəy Bayandurun qardaşı oğlu Əbülfəth bəy çoxlu ordu ilə Kirman tərəfdən Şiraza gəldi. Əmir Yaqubcan bəy məyusluq və pərişanlıq içində Beyza tərəfə qaçdı. Əbülfəth bəy şəhərə gəlib, onun mallarını ələ keçirərək hərəkət bayrağını Kazerun tərəfə yüksəltdi və oradan da Firuzabada yönəldi. Şaban [ayının] 8-də (06.02.1503) oraya çatdı. Bu zaman Mənsur bəy Əfşar qorxuya düşərək qohum-əqrəbası ilə birlikdə onun yanına gəldi. Əbülfəth bəy onu həbs etmək istədi. Xeyirxah şəxslərdən biri onun bu niyyətini gizlicə Mənsur bəyə söylədi. O da kəlmeyi-şəhadət oxuyub bargaha gəldi. Bu əsnada dağ başında bir ceyran göründü. Əbülfəth bəy cürətinin çoxluğu üzündən sıldırım dağın başına qalxdı və zirvədən yıxılıb həlak oldu. Onun ordusu bir-birinə dəydi. Onun əmisi oğulları Şeyx Həsən bəy və Məhəmməd bəy qoşunun dağılmasına imkan vermədilər. Şeyx Həsən bəy onun varisi oldu.

Bu əsnada Əşrəf bəy Bayandurun qardaşı Şeyxəli bəy[1609] bir dəstə cəsur atlı ilə Şiraza yönəldi və şaban [ayının] 11-də (09.02.1503)[1610] Səadət meydanında dayandı. O, hər biri Nəmrudu və Şəddadı[1611] xatırladan kobud və zalım mühəssilləri (vergi məmurlarını) rəiyyətdən vergi yığmağa təyin edib onlardan işgəncə ilə çoxlu mallar topladı. O əsnada Oğuz Məhəmməd izdihamlı bir qoşunla o yaramazı dəf etmək üçün Şiraza gəldi. Şeyxəli bəyə müqayisəyəgəlməz qorxu yol tapdı. O, hərəkət bayrağını Əbərquh tərəfə yüksəltdi. O ətrafda Rəis Məhəmməd Kərrə onu qətlə yetirdi.

[1607] Bakı nüsxəsi: "öncüllük topunu igidlik çövgəni ilə irəli aparan (daha çox igidlik göstərən)".
[1608] Göstərilən miladi tarix şənbə gününə deyil, düşənbə (bazar ertəsi) gününə təsadüf etmişdir. Digər məlumata görə, bu paraqrafda bəhs edilən hadisələr Sultan Muradın Şah İsmayıl qarşısındakı məğlubiyyətindən sonra baş vermişdir *(Cahangüşayi-xaqan, s.176-181).*
[1609] Məclis nüsxəsində Şeyxəli bəy, bəzi digər nüsxələrdə və o cümlədən Baroda və Tehran nəşrlərində Əli bəy yazılmışdır.
[1610] Bakı nüsxəsi: "şaban [ayının] 15-də" (13.02.1503).
[1611] Nəmrud və Şəddad – dini mətnlərdə adları çəkilən qədim dövrün zalım hökmdarları.

## Xorasan vilayətində baş vermiş hadisələr haqqında söhbət

Bu il Bədiüzzaman mirzə, Sultan Hüseyn mirzənin fərmanı və Bədəxşan padşahı Əmir Xosrovşahın xahişi əsasında on iki min süvari ilə Bəlxdən Termezə[1612] doğru hərəkət etdi, Əmir bəy Vəfadarı[1613] Herata göndərdi və yüksək məqamlı atasından kömək istədi. Termez hakimi Əmir Baqi onun hüzuruna tələsdi və qəbul edildi. O zaman Bədiüzzaman mirzə, Əmir Xosrovşahın yanına, Hisari-Şadmana elçilər göndərib onu çağırdı. Amma o, itaət etməyib boyun qaçırdı. Ona görə də Bədiüzzaman mirzə Əmir Zünnun ilə birlikdə Bəlxə qayıtdı.

## Ayqutoğlunun Nasir və Mənsur Türkmanla müharibə etməsi haqqında söhbət

İsgəndər şanlı xaqanın hökmü ilə İlyas bəy Ayqutoğlu Azərbaycanda yerləşdikdən bir neçə gün sonra o diyarın valiləri Nasir və Mənsur Türkman dörd min süvari[1614] ilə sürətli yürüş edərək həmin adlı-sanlı əmirin ordusuna basqın etdilər. Qazilər də ata minib onlara həmlə etdilər. İki tərəf arasında şiddətli bir vuruşma baş verdi. Qızılbaş qoşunları qiyamçı türkmanlara qalib gələrək o hünərsiz qoşundan təqribən min nəfəri qətlə yetirdilər. Nasir və Mənsur Türkman savaş meydanından qaçdılar. Zəfər şüarlı qazilərin əlinə çoxlu qənimətlər düşdü. İlyas bəy həmin diyarda möhkəmlənib onların (qiyamçıların) başlarını İsgəndər şanlı xaqanın ulu dərgahına göndərdi.

## Müxtəlif əhvalatlar

Həmçinin bu il Əmir Zünnunun oğlu Məhəmməd Müqim Kabil üzərinə qoşun çəkdi. Mirzə Əbdürrəzzaq qaçmağı döyüşməkdən üstün tutdu. Məhəmməd Müqim Kabili ələ keçirib Sultan Əbu-Səidin oğlu Mirzə Uluğ bəyin qızını aldı.

Bu il Əbdülbaqi mirzə və Yəzd hakimi Murad bəy Bayandur, *İsgəndər şanlı*[1615] xaqan cənablarının müzəffər ordusunun qorxusundan fərar edib Herata getdilər. Sultan Hüseyn mirzə onları yaxşı qarşılayıb, Əbdülbaqi mirzəyə həddən artıq iltifat göstərərək şərəfləndirdi.

Yenə bu il Dəşti-Qıpçaq seyidləri zümrəsindən olan və özbək xanları ilə çox isti münasibətlər saxlayan Seyid Cəfər xoca Mavəraünnəhrdən Bəlxə tələsib Bədiüzzaman mirzə ilə görüşdü. Zahirən məhəbbətini izhar etsə də, batinən mirzənin yaxın çevrəsini (müqərrəblərini) özünə müttəfiq edərək bir neçə gündən sonra xəyanət etmək niyyətində idi. Ona görə də Bədiüzzaman mirzə, Seyid Cəfər xocanı və onun müttəfiqlərini cəzalandırdı.

## Ölümlər

Sultan Hüseyn mirzənin oğlu Heydər Məhəmməd mirzə bu il öldü.

Həmçinin bu il böyük mövlana, ümmətlər arasındakı ulu fazillərin iftixarı, hikmət fənlərinin ən yaxşı bilicisi, öncül alimlərin öndəri, dərin savada malik bəlağətlilərin ən zəkalısı Mövlana Cəlaləddin Məhəmməd Dəvvani [vəfat etdi]. O, Mövlana Səadəddin Əsədin oğlu idi. [Atası] ali nəsəbi və biliyi ilə məşhur idi. Kazerun mahalının Dəvvan kəndində şəriət qazısı idi. Mövlana cənabları öz atasının yanında təhsil almışdır. Axırda Şiraza gedib Mövlana Möhyəddin Kuşəkənarinin[1616] və Mövlana Həsənşah Baqqalın yanında[1617] kamal öyrənməyə səy göstərmişdi. Mövlana Cəlaləddin eyni zamanda "Təvale" ("Talelər") [əsərinə][1618] dair faydalı şərh yazmış Mövlana Hümaməddin Gülbarinin yanında tədavüldə olan bəzi elmləri mütaliə edib dərs almışdır. Hədis elmini öyrəndiyi zaman Şeyx Səfiəddin İcinin[1619] hüzurunda tələbəlik etmişdir. Gənclik əyyamında bir müddət Cahanşah padşahın oğlu Əmirzadə Yusifin yanında sədr olmuşdur. Sədarətdən sonra indi Da-

[1612] Termez (Tirmiz) – Amudərya çayı üzərində, Bəlxlə Hisari-Şadman arasında yerləşir *(Seddon, şərhlər, s.228).*
[1613] Bakı nüsxəsi: "Əmir Ömər bəy Vəfadarı".
[1614] Bakı nüsxəsi: "dörd min yaramaz"
[1615] Bakı nüsxəsi (40a).
[1616] Kuşəkənar – Buşəhrə bağlı olan bir yerdir *(Nəvai, şərhlər, s.989).*
[1617] Baroda nəşri: "mədrəsəsində"; Nuruosmaniyyə nüsxəsi: "dərsində".
[1618] "Təvale" əsəri h. 617-ci (1220-21) ildə vəfat etmiş Şeyx Nəcməddin əl-Kübra tərəfindən yazılmışdır *(Seddon, şərhlər, s.228).*
[1619] Baroda nəşri, Məclis və Bakı nüsxələrində səhvən "Şeyx Səfiəddin Elçi" yazılmışdır.

rüləytam deyilən Bəyim mədrəsəsində dərs verməklə məşğul olmuşdur. Ağqoyunlu sultanları zamanında Fars məmləkətinin qazılıq mənsəbi ona məxsus olmuşdur. Əhməd padşah İran vilayətində hakimiyyəti ələ keçirdikdən sonra o həzrətə çox hörmət göstərdi. Rum padşahı Sultan Məhəmməd də onun üçün töhfələr və hədiyyələr göndərmişdi. Qasım bəy Pornak, Əhməd padşaha kin bəslədiyi üçün o cənabın çoxlu mallarını müsadirə etmişdi. Axırda o, bu bəladan xilas olub Lar və Cəruna yollandı. Əbülfəth bəy Bayandur Şirazı ələ keçirdiyi vaxt Mövlana Kazeruna yollanıb Fulabginədə[1620] Əbülfəth bəyin ordusuna qoşuldu və əvvəlkindən daha artıq ehtirama layiq görüldü. Amma bir neçə gündən sonra, rəcəb ayında (1503-cü ilin yanvarında) ishal xəstəliyi ucbatından fani dünyadan əbədi cahana köçdü. Cəsədini Dəvvan[1621] kəndinə aparıb Şeyx Əli Dəvvaninin yanında dəfn etdilər. Ömrünün müddəti yetmiş səkkiz il olmuşdur. Əsərləri sırasında bunlar vardır: "Haşiyeyi-qədimi-təcrid" ("Qədim təcrid haşiyəsi") – [bu əsər] Mövlana Əli Quşçunun nəzərinə çatmış və o, insaf üzündən onu təriфləmişdir[1622]; "Haşiyeyi-cədid" ("Yeni haşiyə"), "Haşiyeyi-əcəd" ("Ən yeni haşiyə"), "Şərhi-həyakel" ("Heykəllərin şərhi") – işraq hikməti[1623] haqqında; "Haşiyeyi-mətale" ("Mətlələr haşiyəsi") – məntiq haqqında[1624]; "İsbati-vacibi-qədimü-cədid" ("Qədim və yeni olan vacibin isbatı")[1625]; "Əxlaqi-Cəlali" ("Cəlalın əxlaq kitabı") – "Əxlaqi-Nasiri"nin[1626] müqabilində yazmışdır; "Haşiyeyi-şəmsiyyə" ("Şəmsiyyə haşiyəsi")[1627]; "Haşiyeyi-ənvari-şafiyyə" ("Şəfa verən nurlar haşiyəsi"); "Risaleyi-zəura" – bu risaləni möminlərin əmiri və dindarların imamı olan Həzrət Əli ibn Əbu-Talibin – ona və nəslinə Allahın salamı olsun – müqəddəs və nurlu məqbərəsində bir gün ərzində ayaq üstdə dayanaraq tamamlamışdır və "Zəura"ya da bir şərh yazmışdır; "Haşiyə bər işarat" ("İşarələrə dair haşiyə"); "Haşiyə bər təhzibi-məntiq" ("Məntiq təliminə dair haşiyə")[1628]; "Səvadül-eyn bər hikmətül-eyn" (Varlığın hikmətinə dair göz bəbəyi").

## 909-CU İLDƏ (26.06.1503 – 13.06.1504) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Yaqubcan bəy Türkman böyük[1629] bir qoşunla İsfahandan Şiraza yönəldi. Oğuz Məhəmməddən və Əbülfəth bəydən sonra Farsı ələ keçirmiş Şeyx Həsən bəy Bayandur onun qarşısına çıxdı. Cuyüm[1630] ətrafında böyük bir savaş oldu. Yaqubcan bəy qalib gəldi. Şeyx Həsən bəy həlak torpağı üzərinə düşdü. [Yaqubcan bəy] yenidən Fars məmləkətini ələ keçirib oradan Ərjən çölünə[1631] yönəldi. Qullarına ağa olan səadətli xaqan cənablarının (Şah İsmayılın) qorxusundan fərar etmiş Sultan Murad həmin yerdə ona qoşuldu.

O əsnada xəbər çatdı ki, kama çatmış hökmdar saysız-hesabsız qoşunla onlara doğru gəlir. Ağqoyunlu camaatı idbar üzünü fərar vadisinə çevirdi. Şəhərə çatdıqları zaman əmirlər arasında küdurət peyda oldu. Yaqubcan bəylə Sultan Murad, Seyid Məhəmməd Fəllahın yanına getdilər. Yaqubcan bəy Dizful tərəfə yollandı, oradan Şəhrbana[1632] gəlib, pornak əmirləri ilə görüşmək və Mosul yolundan Diyarbəkrə getmək istədi. O əsnada Qasım bəy Pornakın qardaşı Bəşarət bəy Pornak qardaşının qanının qisası üçün onu öldürdü. Sultan Murad isə Bağdada getdi. Oranın hakimi Barik bəy Pornak onu səltənətə əyləşdirdi.

---

[1620] Fülabginə (Püli-Abginə) – İranın Fars vilayətinin Kazerun şəhristanında kənd.

[1621] Dəvvan – Kazerundan 9 km. şimalda yerləşən kənd.

[1622] "Təcridül-əqaid" – Nəsirəddin Tusinin sxolastik fəlsəfə və onun prinsipləri haqqında yazdığı əsərdir. Bu əsərə yazılmış şərhlər arasında ən məşhuru Əlaədin Əli Quşçunun şərhidir *(Seddon, şərhlər, s.228).*

[1623] İşraq fəlsəfəsinin banisi XII əsr Azərbaycan alimi Şihabəddin Sührəvərdi olmuşdur.

[1624] "Mətaleül-ənvar fil-məntiq vəl-hikmət" əsəri 689 / 1290-cı ildə vəfat etmiş Qazı Siracəddin Mahmud Urməvi tərəfindən yazılmış, Dəvvani isə ona haşiyələr (şərhlər) qələmə almışdır *(Seddon, şərhlər, s.228).*

[1625] Bu əsər metafizika haqqındadır *(Seddon, şərhlər, s.228).*

[1626] "Əxlaqi-Nasiri" – XIII əsr Azərbaycan alimi Nəsirəddin Tusinin əsəridir.

[1627] "Şəmsiyyə" – 693 / 1293-94-cü ildə vəfat etmiş Nəcməddin Əli ibn Ömər əl-Katibi əl-Qəzvininin məntiq haqqında yazdığı əsərdir. Dəvvani bu əsəri şərh etmişdir *(Seddon, şərhlər, s.229).*

[1628] 792 / 1390-cı ildə vəfat etmiş Səədəddin Məsud ibn Ömər ət-Təftazaninin "Təhzibül-məntiq vəl-kəlam" əsərinə dair şərhdir *(Seddon, şərhlər, s.228).*

[1629] Baroda nəşri: "hədsiz".

[1630] Cuyüm (Guyüm) – Şirazdan 20 mil şimal-qərbdə yerləşən qəsəbə *(Seddon, şərhlər, s.229).*

[1631] Ərjən çölü – Şirazdan Buşirə gedən yolun üzərindədir *(Seddon, şərhlər, s.229).*

[1632] Baroda nəşri: "Şəhriyana"; Nuruosmaniyyə nüsxəsi: "Şəhribaza".

**İsgəndər şanlı xaqanın[1633] Şiraza qoşun çəkməsi**

İsgəndər şanlı xaqan Həmədan ətrafında asudəliklə, səadətlə və uğurla vaxtını keçirərkən xəbər yetişdi ki, Sultan Murad Şirazda lövbərini salıb və türkmanların bir dəstəsi onun başına toplaşıb. Bu səbəbdən [İsgəndər şanlı xaqan] hərəkət bayrağını Fars tərəfə yüksəltdi və hərəkət əsnasında Hüseyn Kiya Çəlavinin tüğyanı üzündən İlyas bəy Ayqutoğlunu bir dəstə qazi ilə onu dəf etməyə göndərdi. Ondan sonra [şahın] səadətli bayrağının[1634] hümay quşu Şirazı fəth etmək üçün havada pərvaz etdi. Bundan xəbər tutan Sultan Murad, artıq qeyd edildiyi kimi, Bağdada tələsdi. Dünyanı qoruyan həzrət dövlət və kamranlıqla Şirazın məmləkət gəlinini əğyarın maneəsi olmadan öz yiyəlik ağuşuna çəkdi.

Nəzm

“Xarsız idi Şirazın gülüstanı,
Yoxdu böylə xəzinənin ilanı.
Zəngin bağın bəhrələri çox idi,
Qapısı açıq, bağbanı yox idi”.

Dövlət quşu səadət kölgəsini o diyarın üzərinə saldı və hökmdarın parlaq günəşi həmin bəxtiyar bölgəni şərəfləndirdi və nurlandırdı[1635]. Fələyin peyki fəth və zəfər xəbərlərini cahan sakinlərinin qulaqlarına çatdırdı. Aləm ədalət və insaf təravəti ilə yamyaşıl və təzə-tər oldu. O həzrətin xeyirxah könlü Fars məmləkətinin işlərindən arxayın olduqdan sonra İraqa doğru tələsdi. O uca günəşin bayrağının ayparası Qum şəhərinin üfüqündən doğduqda və o həzrətin günəşə bənzər siması o məmləkətin ətrafına işıq saçdıqda, ətrafdakı hakimlər və çevrədəki sərdarlar ümid üzünü cahanın pənahı olan dərgaha tutub gəldilər və hökmdarın lütfləri ilə iftixarlı və başı uca oldular.

**İsgəndər şanlı xaqanın Firuzkuha[1636] getməsi və o şövkətsiz güruhu qırıb-biçməsi haqqında söhbət**

İlyas bəy Rüstəmdara gedərkən Əmir Hüseyn Kiya Çəlavi onun üzərinə sürətlə yürüş etdi. İlyas bəy onun hərəkətindən xəbər tutub, hərəkət yüyənini Vəramin qalasına doğru çevirərək çapdı. Divə bənzər rüstəmdarlılar o qalanı mühasirəyə aldılar. Amma qalanı döyüşlə fəth edə bilməyəcəklərini anladıqda məkrə və hiyləyə əl atdılar. İlyas bəyin yanına elçilər göndərib sülhdən söz açdılar. Əhd-peyman bağlandıqdan sonra [İlyas bəy] çoxlu adamla qaladan çıxıb düşmənlərin yanına gəldi. Hüseyn Kiya Çəlavi əhdini pozub onu cəmi mülazimləri ilə birlikdə qətlə yetirdi.

Bu xoşagəlməz xəbər və təşvişli hadisə İsgəndərə bənzər xaqanın qulağına çatdıqda, yaz fəslinin əvvəllərində tale rəssamı yer üzünü Çin nigarxanasını qısqandıracaq şəkildə gözəlləşdirdiyi və qüdrət məşşatəsinin lalənin rüxsarını şeh damlaları ilə bəzədiyi vaxt,

“Novruz küləyi müşk kimi olduqda,
Gül və qönçə könülləri oxşadıqda,
Ağac yarpaq və meyvə ilə bəzəndikdə,
Güllərin sultanı taxtın üzərinə çıxdıqda,
Yarpağın dəfi küləyin əlində titrədikdə,
Azad sərv orada cilvələndikdə,
Qönçənin dodağı şəbnəmə bulaşdıqda,
Dodağı məlahətdən dadlandıqda”,

qəzavü-qədər kimi cərəyan edən fərman verildi ki, zəfər nişanlı qazilər və qələbə şüarlı əsgərlər o güruhu qırıb-biçmək üçün hərəkət yüyənlərini Firuzkuhun Gülxəndan qalasına doğru yönəltsinlər, Rey yaxınlığındakı Vəramin yolundan daxil olub o ərazini izzət və calal çadırlarının düşərgəsinə çevirsinlər. İsgəndər şanlı xaqan yekşənbə günü, mübarək ramazan ayının 9-da (25.02.1504), tonquz (donuz) ilində hərəkət yüyənini Qum şəhərindən o səmtə doğru yönəltdi. Rey ətrafında Novruzi-sultani sübhünün dan şəfəqləri İlahi təsdiq üfü-

---

1633 Bakı nüsxəsi: “Düşmənləri yox edən xaqanın”.
1634 Baroda nəşri: “düşüncəsinin”.
1635 Bakı nüsxəsi: “zinətləndirdi”.
1636 Məclis nüsxəsi: “Usta və Firuzkuh qalası tərəfə”; Bakı nüsxəsi: “Firuzkuhun Usta qalası tərəfə”.

qündən doğdu. O mübarək gündə "dövlət sahibləri bəzi məsələləri ilham yolu ilə bilirlər" hədisinə uyğun olaraq, Cəmşid məqamlı şahın ağzından çıxdı ki, "Gülxəndan qalasının fəthi ramazan bayramında baş verəcəkdir".

O zaman Sultan Hüseyn mirzənin oğlu Məhəmməd Hüseyn mirzə ali mənşəli xaqana mülazimlik ehramını geyib Astarabaddan Simnana gəldi və bir həmlə ilə o şəhərin qalasını ələ keçirdi. Hüseyn Kiya tərəfindən qala kutvalı olan Əmir Əfrasiyab Çəlavi ərkə (iç qalaya) pənah aparıb, ildırım və külək kimi sürətli bir qasidi Hüseyn Kiyanın yanına göndərdi və bu əhvalatı ona ərz etdi. Hüseyn Kiya Çəlavi, Murad bəy Cahanşahlu ilə ittifaqda və bir dəstə Ağqoyunlu dilavəri ilə birlikdə dərhal Simnana doğru sürətli yürüş etdi. O azğın güruh qəflətən cağatay qoşununa həmlə etdi və onları pərən-pərən saldı. O yaramazların sərdarı (Hüseyn Kiya Çəlavi) çoxlu mallarla öz diyarına qayıtdı. Şənbə günü, sözügedən ayın 29-da (16.03.1504) Gülxəndan qalasının[1637] ətrafı müzəffər qoşunların çadırlarının düşərgəsinə çevrildi. O, elə bir qaladır ki, möhkəmliyi ilə məşhur olmuş, mətanəti ilə tanınmışdır. Hündürlükdə göy qübbəsi ilə baş-başa, ucalıqda Əkizlər bürcü ilə bərabərdir.

Şeir

"Himmət divarı kimi hündür bir hasar,
Zərərin əli ona uzanmaq üçün qısadır.
Divarının başı fələklə bərabərdir,
Orada göyərçin kimi oturmuşdur mələk.
Ağıldan və zəkadan uzaq bir güruh,
Orada üsyankarlıq kosunu vurur".

Qələbə nişanlı qazilər hər tərəfdən o qalaya üz tutub hərb və döyüş atəşini alovlandırdılar. O pis aqibətli firqədən hər kim idbar başını hasarın üstündən bayıra çıxardısa, onun gözü can odlayan oxun ucu ilə deşildi. Qala camaatı can qorxusundan daş və ox atırdı. İki gün ərzində qala əhli ilə qələbə şüarlı qoşunlar arasında hərb və döyüş baş verdi. O əsnada ordu dilavərləri və lağımçılar ali məqamlı şahın əmri ilə dörd tərəfdən lağım vurdular. O qalanın bürcləri dağılmağa başladı. Qala sakinləri bu hadisənin baş verməsindən sonra aman dilədilər. Qazilər onları dustaq edib, dünyanın pənahı olan dərgaha gətirdilər. Qəzəbli qəhrəman (Şah İsmayıl) onların qətlinə fərman verdi. Beləliklə, qalanın fəthi, o həzrətin buyurduğu kimi, Fitr bayramı günü baş verdi. Ondan sonra zəfər təntənəli ordu Firuzkuh qalasına doğru hərəkətə gəldi. Pəncşənbə günü, şəvval ayının 11-də (28.03.1504) qalanın ətrafında cah-calalla dayandılar. O, səma kimi olduqca hündür bir qala idi və möhkəmlikdə İsgəndər səddinə bənzəyirdi.

Nəzm

"Küngürəsi asimana elə sürtünüb ki,
Günəş oradan yan keçir".

Qalanın kutvalı Əli Kiya Zəmandar müxaliflikdə israr edib savaş və döyüş əlamətlərini zahir etdi.

"O, qalanın möhkəmliyinə aldanıb yolundan çıxdı,
Ona görə də ağılsızca yıxılıb quyuya düşdü.
O qalanın hündürlüyü onu yanıltdı,
Onu başı aşağı saldı çuxura.
Bilmədi ki, o dağın yüksəkliyi,
Çərxi-fələyin qarşısında şövkətsizdir".

Bu xəbər [Şah İsmayılın] nurlu könlünə bəlli olduqda, [dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin şahının çöhrəsində dəyişiklik əlamətləri peyda oldu və mübarək alnında kin nişanələri göründü. O, hərb və mühasirə alətlərinin hazırlanmasına, müharibə ləvazimatının tərtib edilməsinə dair fərman verdi. Adlı-sanlı əmirlər və aslan ovlayan igidlər göyə ucalan o qalanı hər tərəfdən mühasirəyə aldılar və qəhr barmağı ilə ciyər deşən ox qartalını uçurtdular.

Rüstəmdarlılar müdafiə olunmağa başladılar. Əksər günlərdə səhərdən axşamacan savaş və döyüş alovu, hərb və vuruş atəşi yanıb şöləléndi. Xaqan həzrətləri öz nəfis vücudu ilə çox çalışdı; belə ki, düşmən-

[1637] Tehrandan şərqdə yerləşir.

lərə qarşı öz əli ilə min dənə ox atdı. Ertəsi gün ordu şahın razılığı ilə ay ətrafındakı ulduzlar kimi düşmənlərə doğru kamandan meteora bənzəyən alovlu oxlar yağdırmağa başladı.

Beyt

“Gedir ox düşmənlərə doğru kamandan,
Necə ki, şeytanların üstünə yağır atəş asimandan”.

Qala camaatı ciyər deşən və atəş saçan oxların qorxusundan bürclərin başından geri çəkildilər və min təşvişlə nəfəslərini içlərinə çəkdilər. Hökm olundu ki, cəngavərlər qalanın kənarından axan çaydan keçsinlər və fəthə başlasınlar. Zəfərə yaxın olan əsgərlərin hərəkətlənməsindən öncə o mətin qalanın bürclərindən biri yer səthinə qonşu oldu (dağılıb yerə töküldü). Həmin bürc uçulduqdan sonra qazilər qalaya yönəldilər. Oranın sakinləri ox və daş atdılar. Qalib qoşundan yaralananlar və yıxılanlar oldu. Amma digərləri vurulmuşları arxaya çəkib[1638] irəliləyirdilər. Bu arada döyüş meşəsinin aslanı Mahmud bəy Qacar adlı-sanlı dilavərlərin hamısını geridə qoyub, təkbaşına o qalanın divarı üzərinə çıxaraq bədkirdar rüstəmdarlıları ov heyvanları kimi pərən-pərən saldı və bahadırlar qalanın ilk təbəqəsini ələ keçirdilər. Düşmənlər can qorxusundan narınqalaya qaçdılar. Onları müqayisəyəgəlməz vahimə bürümüşdü. Əli Kiya Zəmandar qorxusundan dikbaşlığın və zalımlığın zirvəsindən üzrxahlıq və yalvarış çökəkliyinə düşüb Nəcm bəyin[1639] vasitəçiliyinə əl atdı. Ona görə də o həzrət (Şah İsmayıl) o camaatın qanının üstündən keçdi. Əli Kiya Zəmandar qorxaq-hürkək halda qaladan çıxıb, astananı öpmək şərəfinə nail olaraq qalanı təslim etdi. Şahın mərhəməti onun təqsirlərini lütfkarlıq suyu ilə yudu. Qazilər onun ordusundan olan bəzilərini inadkarlıq göstərdikləri üçün qətlə yetirdilər.

## Usta qalasının fəthi və Hüseyn Kiyanın qətli haqqında söhbət

Şəvval [ayının] 24-də (10.04.1504) fəth və uğur bayrağı calal sahibi olan məlikin (Allahın) himayəsi altında Usta qalasına yönəldi. O, elə bir qaladır ki, yüksək bir dağın başında yerləşir və onun istehkamı aləmin ətrafında məşhurdur.

Nəzm

“Binası daş ürəklilərin ürəkləri kimi,
Qapısı xəsislərin evi kimi bağlı.
Divarları göyün yeddi qatından uca,
Xəndəyinin dərinliyi yerin dibinə çatır.
Xəndəyinin ağzı ölümün astanasıdır,
Oradan yoxluq mülkünə qədər bir addımdır.
Onun dərinliyi o qədər çoxdur ki,
Səmadan onun içinə ay və günəşin işığı düşməz.
Kiya çün agah oldu şahın uğurundan,
Qorxusundan o qalaya apardı pənah”.

Zəfərə öyrəşmiş ordu qala ətrafında çadır, alaçıq, saray pərdəsi və bargah qurduqdan sonra hökmdar fərman verdi ki, qalaya bitişən bir keçiddən keçsinlər və qalanı fəth etsinlər. Zəfər şüarlı əsgərlər o yolla irəlilədilər, gecə ilə gündüzün bir-birini əvəzlədiyi kimi, bir-bir oradan keçdilər.

Nəzm

“Pələng dərisi geymiş cəngavərlər,
O yüksək dağa ayaq qoydular”.

Divə bənzər rüstəmdarlıların bir qismi müharibə və savaş qədəmini önə qoydular, hərb və fitnə alovunu alışdırdılar.

Nəzm

“Əvvəlcə əl atdılar daşa,
Çoxlu baş və əl qırıldı.
Pəhləvanlar da qol açdılar ox atmağa,

[1638] Nuruosmaniyyə nüsxəsi və Baroda nəşri: “önlərindən çəkib”.
[1639] Məclis nüsxəsi: “Mahmud bəyin”.

O div görkəmlilərdən gəldi ahu-zar səsi.
Daşdan sümüklər oldu çilik-çilik,
Sınmış sümük bədənə iti ox kimi batırdı".

Adlı-sanlı əmirlərdən Əbdi bəy Təvaçı öz qoşununda olan bir dəstə şamlu ilə, divan əmiri (əmiri-divan) Bayram bəylə və Bəhram [kimi] intiqamçı olan digər dilavərlərlə birlikdə hərb və qırğın qılıncını kin qınından sıyırıb mərdlik və igidlik nümayiş etdirdilər. Dava zamanı Əbdi bəy ox yarası aldı. O dar yer qaniçən qılıncları işə salmaq üçün münasib meydan deyildi. Ona görə də dilavərlər məqsədlərinə nail ola bilmədilər və o mövqeyi azğınlar zümrəsindən azad etməyi bacarmadılar. Şahın qeyrətinin və padşahın şərəfinin kamalı qala əhlinin gümanına gəlməyən başqa bir yerdən qalanın ətəyinə cah-calalla nazil olmağı qərara aldı. O zaman zəfərin mənsub olduğu üzənginin ətrafında iki yüz nəfərdən artıq mülazim yox idi. Halbuki qala ətəyində səf bağlamış düşmən qoşununun sayı üç mindən çox idi. Onlar müzəffər ordunun azlığını görüncə, döyüşmək üçün irəli atılmaq istədilər. Xaqan həzrətləri İlahi yardım ilə onlara həmlə etdi. O güruh şövkətli qoşunun igidliyinin cüzi bir qismini müşahidə etdikdə və dadını aldıqda bildi ki, zəhmətləri əbəs və mücadilələri bihudədir. Fərar yolunu tutdular və qalaya qaçdılar. Sözügedən keçiddə adlı-sanlı əmirlərə müqavimət göstərməkdə olan camaat bu xəbəri eşitdikdə Binatün-nəş kimi pərən-pərən düşdülər. Fələk vüqarlı əmirlər özlərini izzət və calal bayraqlarına yetirdilər. Ondan sonra zəfərin varid olduğu ordu Həblərud çayı kənarında dayandı. Sayəbanlar ucaltdılar, çadırlar qurdular.

Nəzm

"Dağın və çayın ətrafına,
Qan tökmək üçün qondu ordu.
O yamacdakı dəmir bədənlilər lərzəyə düşdülər,
İynə kimi yırtığın içinə sığındılar".

Əksər günlərdə əzəmətli qazilər və zəfər aqibətli əsgərlər aləmi işıqlandıran günəşin mavi hasar üstünə üfüq qınından zərnigar qılınc çəkdiyi zamandan ta hilalın gümüş qalxanı uca göydə zahir və peyda olan vaxta qədər xəndəyin qarşısına gedib ordu səfi qururdular. Hüseyn Kiyanın adamları dəyərli bir matah olan canlarını qorumaq üçün qala divarlarının və bürclərin başına çıxmadan ox və tüfəng atırdılar və ürək deşən oxla dikbaşların başına dəbilqəni tikirdilər. Qraniti dələn ox fəzanın havasında can odlayan şölələr yandırır, topun nərəsi ölüm sədasını igidlərin huş qulağına çatdırır və zərbzən səsi bahadırların bədəninə lərzə salırdı. Tüfəng gülləsi damarlardakı qan kimi süzülərək, canı bədəndən ayırırdı.

"Tüstüdən gecə kimi oldu fələyin fəzası,
Oranın ulduzları tüfəng gülləleridir".

Qarşısında cahanın müti olduğu hökm verildi ki, Hüseyn bəy Lələ mücadilə meydanının igidlərindən [ibarət] bir dəstə ilə mühasirədəkilərin həyat mənbəyi olan Həblərud çayını başqa bir səmtə yönəltsin. Hüseyn bəy hökmü yerinə yetirdi. Qala əhli o halın baş verməsindən sonra öz gəmilərinin ölüm dənizinə batdığını gördülər və susuzluq atəşi onların dözüm xırmanını yandırdı. Hüseyn Kiya bu vəziyyəti müşahidə etdikdə peşmançılıq barmağını dişinə qoydu və bəla dairəsinin əhatəsində bir nöqtə kimi çaş-baş qaldı. Suyun kəsilməsinin üçüncü günü mühasirədəkilər tab gətirməyib, Hüseyn Kiyanın sığınacağı olan iç qalaya (ərkə) sarı üz tutdular. Daha üç gün savaş və qalmaqal tozanağı davam etdi. Seşənbə günü, zilqədə [ayının] 27-də (12.05.1504)[1640] o mövqe də ələ keçirildi. Usta qalasının və ərk qalasının bütün əhli ölüm şərbətini içdi.

Nəzm

"Ərk əhlini qılıncdan keçirdilər,
Onlar qala divarından və bürcdən yarpaq kimi töküldülər.
Yaramazların başı diyirləndi top kimi,
Qan selindən küçələr arx oldu.
Dər-divar qan selindən nəm tutdu[1641],
Saray tavanındakı taxtalar əyildi.

---

[1640] Bakı nüsxəsində "şənbə günü" yazılmışdır. Əslində isə həmin gün nə şənbə, nə də seşənbə deyil, yekşənbə gününə təsadüf etmişdir.
[1641] Tehran nəşrində səhvən "qəm tutdu" yazılmışdır.

Asimana o qədər ruh uçdu ki,
Günəş ruhlar dənizinə qərq oldu".

Murad bəy Cahanşahlu, Satılmış, Hüseyn Kiyanın qohumları və yaxınları, ümumiyyətlə təqribən on min nəfər cəzasına çatdı (öldürüldü). Hüseyn Kiya bayquş kimi dəmir qəfəsdə məhbus oldu. O, gözətçilərin diqqətsizliyindən istifadə edib özünü yaraladı, amma sağ qaldı. Zilhiccə [ayının] 3-də (18.05.1504) hökmdarın ordusu qala ətəyindən köç etdi. Rey və Savuxbulağa yönəldilər. Kəbud-günbəd[1642] adı ilə məşhur olan Eyvani-Rəəsül-Vadi mənzilində Hüseyn Kiya Çəlavi özünə vurmuş olduğu yara ucbatından dünyasını dəyişdi. Onun hiyləgər qarğası (ruhu) bədən qəfəsini boşaltdı.

"Qəfəs kimi parçalanmış sinəsi ilə,
Qəfəs içində həlak oldu həqarətlə".

Qəribə təsadüflərdəndir ki, o, İlyas bəy Ayqutoğlunu həmin yerdə öldürmüşdü. İlahi cəza qəhrəmanı intiqam almaq məqamında "Allah yenilməz qüvvət sahibi, intiqam sahibidir!"[1643] [ayəsinin] buyruğuna uyğun olaraq, ölümündən bəhs etdiyimiz şəxsin (Hüseyn Kiya Çəlavinin) [həyat] dəftərini elə həmin yerdə ölüm və yoxluq fərmanı ilə bağladı.

Savucbulaqda Ərdəsənd qalasının hakimi Əmir Söhrab Çəlavi aləmin pənahı olan dərgaha gəldi və [şahın] kimya kimi təsirli nəzərləri qarşısına çıxdıqdan sonra geri döndü. Kama çatmış yüksək şanlı hökmdar oradan Xərrəqan yaylağına[1644] yönəldi. İstinadiq qalasının[1645] camaatı oranın kutvalı ilə birlikdə aləmin pənahı olan dərgaha yönəlib o mənzildə orduya qoşuldular. İsgəndər şanlı xaqan qələbə nişanlı bayraqlarını Surluq yaylağına[1646] tərəf qaldırdı. O mənzildə Məhəmməd Kərrənin tüğyanı xəbəri cah-calallı [hökmdarın] qulağına çatdı.

### Şeybək xan Özbəyin Bəlxi və ətrafını mühasirə etməsi haqqında söhbət

Bu il Əmir Məhəmməd Bağır Tərxanın xahişinə əsasən, Şeybək xan çoxlu ordu ilə Kərki keçidindən keçib Bəlxə yönəldi. Şeybək xanın gəlişindən xəbərdar olan Bədiüzzaman mirzə öz oğlu Məhəmməd Zaman mirzəni bir dəstə dilavərlə o şəhərdə qoyub hərəkət bayrağını San və Çaharyek[1647] səmtinə doğru qaldırdı. Şeybək xan bir dəstə özbəyi Şibirğana basqına yolladı. Əmir Ömər bəyin oğlu Əmir Əli Tərxan[1648] vuruşmaq əzmi ilə az adamla qaladan çıxdı, dava-qırğından sonra əsir alındı. Şeybək xan on min cavanla Şütürxar darvazası önündə dayandı. Xanın qardaşı Mahmud sultan İraq darvazasına gəldi. Bədkirdar özbəklər o qalanı mərkəz kimi əhatəyə aldılar. Xəndəyin suyunu başqa bir tərəfə axıtdılar. Hər gün qaragün özbəklər ata minib qala qapısına gəldilər və döyüşdülər. Lakin şəhərlilərin əlindən ciddi yaralar alıb məyus və uğursuz halda geri döndülər. Bir gün Şeybək xan bir dəstə bahadırla qalaya yürüş etdi. Onun əsgərlərindən təqribən beş yüz nəfər öldürüldü. Bu şəkildə həmin qorxmaz güruh daha iki dəfə Bəlxə hücum etdi. Ancaq yenə də bir iş görə bilməyib geri döndülər. O azğın güruh üç ay şəhər ətrafında oturdu. Axırda başa düşdülər ki, qalanı tutmaq asan olmayacaqdır. Qışın əvvəllərində qayıdış təbilini döyəcləyib Səmərqənd tərəfə tələsdilər.

### Müxtəlif əhvalatlar

Bu il Gilan valisi Karkiya Mirzə Əlinin qardaşı Karkiya Sultan Həsən bol peşkəşlə İsgəndər şanlı xaqanın dərgahına gəldi. O həzrət ona hörmət və ehtiram göstərdi və qayğıkeşlik günəşi onun başına lütfkarlıq kölgəsi saldı.

---

[1642] Savuxbulaq (Savucbulaq) və Kəbud-Günbəd – Rey bölgəsindədirlər *(Seddon, şərhlər, s.230).*

[1643] *Qurani-Kərim, "Ali-İmran" surəsi, 4-cü ayə.*

[1644] Həmədanla Qəzvin arasında yerləşir.

[1645] Müasir İran coğrafiyasında Ərdəsənd və İstinadiq adlı bir məkan tapmaq mümkün olmadı *(Nəvai, şərhlər, s.999).* Bakı nüsxəsində "İstinaqid" yazılmışdır.

[1646] Sultaniyyə yaxınlığındadır.

[1647] San və Çaharyek (Çaryek) – Şibirğan yaxınlığındadır *(Seddon, şərhlər, s.231).*

[1648] Baroda nəşrində səhvən "Əmir Əli Tərxan və Əmir Ömər bəy" yazılmışdır. "Həbibüs-siyər"ə görə də "Əmir Ömər bəyin oğlu Əmir Əli Tərxan" olmalıdır (bax: *Nəvai, şərhlər, s.999*). Bakı nüsxəsində də "Həbibüs-siyər"daki düzgün variant əksini tapmışdır.

Həmin il İsgəndər şanlı xaqan, Məlik Mahmudcan[1649] Deyləmi Qəzvinini vəzirlikdə Əmir Zəkəriyya Keçəçiyə (və ya: Köcəci) şərik etdi. Yenə bu il sədarət[1650] mənsəbi Qazı Məhəmməd Kaşiyə həvalə edildi.

**Ölümlər**

Qazı Mir Hüseyn Yəzdi[1651] bu il xaqanın qəzəbinə giriftar olub həyat dəftərinin vərəqlərini yoxluq küləyinə verdi. Əsərləri sırasında bunlar vardır: "Haşiyeyi-şəmsiyyə" ("Şəmsiyyə haşiyəsi") – məntiq haqqında; "Şərhi-hikmətül-eyn" ("Varlıq hikmətinin şərhi"); "Şərhi-hidayət" ("Hidayətin şərhi") – hikmət haqqında; "Haşiyeyi-təvale" ("Talelər haşiyəsi") – kəlam haqqında; "Şərh bər kafiyeyi-nəhv" ("Kifayətedici nəhv" əsərinə dair şərh); "Risaleyi dər fənni-qəribi-müəmma" ("Qəribə müəmma fənninə dair bir risalə"); "Şərhi-divani-Əmirülmöminin" ("Əmirülmöminin divanının şərhi").

## 910-CU İLDƏ (14.06.1504 – 03.06.1505) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın Yəzd tərəfə qoşun çəkməsi və Kərrənin öldürülməsi

Xaqanın qorxusundan Murad bəy Bayandurun Yəzdi tərk edib Herata getdiyi zaman onun yoxluğundan istifadə edən Yəzd vəziri Xoca Sultan Əhməd Saruyi[1652] şəhəri zəbt etmişdi. Hökmdar (Şah İsmayıl) Namurad üzərindəki qələbədən sonra Yəzd hakimliyini Hüseyn bəy Lələyə həvalə etdi. O cənab da öz tərəfindən Şüeyb ağanı daruğa təyin edib yolladı. Hökmdar fərman verdi ki, Şah Təqiəddin[1653] Məhəmməd İsfahani Yəzdə gedib Sultan Əhməd Saruyini inadkarlıq və ziddiyyət mövqeyindən daşındırsın və onu itaətə meyilləndirsin. Şah Təqiəddinin gözəl səyləri nəticəsində tərəflər arasında sülh qaydaları möhkəmləndi. Sultan Əhməd əhd etdi ki, ömrü boyunca İsgəndər şanlı xaqana itaət yolundan çıxmayacaqdır və Şüeyb ağaya tabe olacaqdır. O zaman Şüeyb ağa Yəzdə gəlib bir neçə gün hakimlik etdi. Sultan Əhməd əhdi pozub onu hamamda qətlə yetirdi və onun dostlarını da öldürüb istiqlal ilə hökumətə əyləşdi. Amma həmin vaxt Məhəmməd Kərrə Əbərquhdan sürətli yürüş edib gecə yarısı özünü Yəzd şəhərinə saldı, Sultan Əhmədi qətlə yetirdi və şəhəri zəbt edib istiqlal bayrağını yüksəltdi. Axırda nəfsani təxəyyüllərə və şeytani hisslərə qapılaraq, İsgəndər şanlı xaqanın ona göstərdiyi qayğıkeşliyin hüququnu unutqanlıq tağı üzərinə qoyub qiyam və üsyan kəlmələrini dilə gətirdi. Uca şanlı xaqan onun müxaliflik xəbərini eşitdikdə, rəcəb ayında (08.12.1504 – 06.01.1505) çoxluq etibarilə ulduzların sayına yaxın və birlik etibarilə Yeddiqardaş (Ülkər) ulduzuna bənzəyən bir ordu ilə Surluqdan Yəzdə yönəldi. Elə bir mövsüm idi ki, istinin şiddətindən igidlərin bədəni atəş kimi odlanırdı və döyüşçülər zireh və xəftanın içində yanırdılar. Havanın hərarəti cəhənnəm odunun şöləsini xatırladırdı və qındakı qılınc mum kimi əriyirdi[1654].

Nəzm

"Elə idi ki, qılınc su damcısı kimi,
Axıb tökülürdü döyüşçünün ovcundan".

Qələbə şüarlı əsgərlər şəhəri mühasirəyə aldılar. Hər iki tərəfdən bacarıqlı kişilər savaş alovunu alışdırdılar. Aşağıdan yuxarıya və yuxarıdan aşağıya oxlar və daşlar atılmağa başlandı.

Nəzm

"Rüstəm kimi igidlərin kamanının oxu,
Dua oxu kimi getdi asimana.
O döyüş meydanında oxların ucundan,
İnsanlar görmədi günəşlə ayı.
Bir-birinə dəyən daşların çoxluğundan,
Yerin başı yüksəlib asimanı keçdi.

---

1649 Baroda nəşri: "Mahmudxan".
1650 Baroda nəşrində səhvən "vəzarət" yazılmışdır.
1651 Qazı olmaqla yanaşı, həm də alim və şair olmuşdur *(Nəvai, şərhlər, s.1000).*
1652 Bakı nüsxəsi: "Saruq".
1653 Məclis nüsxəsi: "Nəqiəddin".
1654 Az öncə müəllif bu yürüşün dekabr ayında baş verdiyini bildirir, lakin daha sonra həmin vaxt havanın çox isti olmasından bəhs edir. Yəqin ki, burada havanın dekabr ayı üçün səciyyəvi olmayacaq dərəcədə isti olduğuna işarə edilmişdir.

O çaxnaşmada qalanın hasarı,
Manqalın kənarları kimi deşik-deşik oldu".

İki ay ərzində hər gün məşriq üfüqündən dan yerinin nurani bayrağı görünən vaxtdan ta günəşin qılıncının qürub hicabının qınına girdiyi zamana qədər kin və döyüş qılıncları sıyrılmış, savaş və hərb bayraqları yüksəldilmiş olurdu. Bu arada izdihamlı ordu birdən şəhərə daxil olub kəsici qılıncın və can odlayan nizənin zərbəsi ilə Kərrənin nökərlərindən çoxunu qətlə yetirdi. Məhəmməd Kərrə az adamla narınqalaya qaçıb yenidən vuruşa başladı. Daha bir ay keçəndən sonra o qalanı da fəth etdilər. "Harada olursunuz olun, hətta uca [möhkəm] qalalar içərisində olsanız belə, ölüm sizi haqlayacaq"[1655] ayəsinin məzmunundan xəbərsiz və məlumatsız olan Kərrə "nağaraxana" deyilən yüksək bir bürcün başına pənah apardı. Əmr olundu ki, Kərrənin sığındığı bürcün altına çoxlu odun toplayıb yandırsınlar. Qazilər buyruğa əməl etdilər. Həmin atəşin şöləsi ona çatdı. Kərrə hərarətin şiddətindən mənzilin pəncərəsinə çıxdı. Qazilər həmin pəncərəyə nərdivan dayayaraq onu iki nəfərlə birlikdə aşağıya endirdilər. İsgəndər şanlı xaqan buyurdu ki, Məhəmməd Kərrəni Hüseyn Kiya kimi dəmir qəfəsə salsınlar.

Nəzm

"Qəzəb kəhərini üstünə çapdılar,
Onu quş kimi qəfəsdə əsir etdilər.
Onun vücudu üçün qəfəs bəxtsizlik tələsi oldu,
O, dəmir zindana giriftar oldu".

Həm də o cahilin bədəninə bal sürtdülər ki, arıların iynəsindən bol-bol əzaba düçar olsun. Xülasə, bir müddət məhbus oldu. Nəhayət, İsgəndər şanlı xaqan Təbəs yürüşündən qayıtdıqdan sonra Kərrəni və onun Əbdi bəy tərəfindən Əbərquhdan gətirilmiş bir sıra nökərlərini İsfahan meydanında yandırdılar.

**İsgəndər şanlı xaqanın Təbəs tərəfə sürətli yürüş etməsi haqqında söhbət**

Aliməkan xaqan Yəzdin mühasirəsi ilə məşğul olduğu zaman Sultan Hüseyn mirzənin yanından Əmir Kəmaləddin Hüseyn Sədr gəldi və büsatı öpmək şərəfinə nail olub gətirdiyi məktubu təqdim etdi. O məktubda məşriqin və məğribin xaqanının ünvanına münasib ibarələr yazılmadığı və ehtiram göstərilmədiyi üçün Əmir Kəmaləddin Hüseyn hörmətlə qarşılanmadı və o həzrət (Şah İsmayıl) Xorasana yürüş etmək fikrinə düşdü. Şabanın (07.01-04.02.1505) əvvəllərində o, biyaban yolu ilə Məsinan Təbəsinə tərəf sürətli yürüş etdi. Elə sürətlə hərəkət edirdi ki, səbanın yüngül yüyənli atı onun köhlən atının tozuna çata bilmirdi və günəşin yenilməz şahsüvarı onun ağ-boz atına yoldaş olmaqdan aciz qalırdı.

Beyt

"Ordudan sürətli gedən bu süvaridən,
Günəş öyrəndi yeyin rəftarı".

Həmin zaman Tərdi Baba, Əmir Məhəmməd Vəli bəyin tərəfindən Təbəs hakimi idi. O, müzəffər ordunun hərəkətindən agah olduqda qalaya tərəf tələsdi. Qazilər dərhal Təbəs şəhərinə basqın etdilər və qarşılaşdıqları hər kəsi o biri dünyaya yolladılar. Təbəs əhalisindən təqribən yeddi min nəfər öldürüldü. O qırğından sonra cahangir hökmdarın qəzəb atəşi yatdı, hərəkət yüyənini Yəzdə tərəf çevirdi və qeyd edildiyi kimi, İsfahanda cah-calalla dayandı.

Qələbə şüarlı qoşunun keçişi üzündən aclıq alovu yayıldı və acların ürəyinin tüstüsü atəş kürəsindən keçdi. Ona görə də İsgəndər şanlı xaqan, Əmir Qiyasəddin Məhəmmədi çağırıb ona buyurdu ki, bu qışda qələbə nişanlı əsgərlərə bol taxıl sat! Adı çəkilən şəxs and içdi ki, mənim anbarımda heç öz adamlarıma bəs edəcək qədər taxıl yoxdur. Bu səbəbdən İsgəndər şanlı xaqan onun qətlinə fərman verdi və qazilər onu öldürdülər.

Elə həmin gün bəzi bədxah adamlar ali məqamlı xaqana ərz etdilər ki, Şah Təqiəddin Məhəmməd, *Sultan Əhməd Saruqi (Saruyi) ilə*[1656] məktublaşmışdır. Onu da qətlə yetirdilər.

---

[1655] *Qurani-Kərim, "Nisa" surəsi, 78-ci ayə.*
[1656] Bakı nüsxəsi (48b).

### Mavəraünnəhrdə baş vermiş hadisələr haqqında söhbət

Bu il Mahmud sultan öz qardaşı Şeybək xanın buyruğu ilə Qunduza yönəldi. Əmir Xosrovşah, Əbdürrəhman bəyi ordunun bir dəstəsi ilə “dil” tutmaq üçün onun qarşısına göndərdi. Onlar Sali-saray hüdudunda çaydan keçdilər. O ətrafda Mahmud sultana yetişdilər. Hərb alətlərinə əl atdılar. Vuruşma əsnasında Əbdürrəhman bəyin çiyninə ox dəydi və o, qaçmağa üz qoydu. Elə ki qaçanlar şəhərə gəldilər, Əmir Xosrovşaha böyük bir xof yol tapdı. O, Qunduzu tərk edib Kuhistana yönəldi. Mövlana Məhəmməd Türküstani kiçiklərin və böyüklərin könlünü Şeybək xana tərəf cəlb etdi. Hərçənd o ətrafda olan Əmir Zünnun adam göndərib, “yaxşısı budur ki, mən elə bu gün düşməni yandıran ordu ilə birlikdə şəhərə daxil olum və özbəkləri dəf edim” deyə ismarış versə də, Mövlana bu sözü qəbul etmədi. Ona görə də Əmir Zünnun qanla dolu ürəklə Mirzə Bədiüzzamanın ordusuna gəlib qunduzluların inadkarlığını ərz etdi. Əmir Zünnunun çıxıb getməsindən sonra Mahmud sultan çoxlu ordu ilə Qunduza gəlib o şəhəri ələ keçirdi.

### Babur padşahın Kabil şəhərini tutması haqqında söhbət

Elə ki Şeybək xan ikinci dəfə Səmərqəndi istila etdi, Babur padşah Əndican tərəfə tələsdi. Tədricən tamam Türküstan və Əndican məmləkəti Şeybək xanın əlinə keçdi. Məhəmməd Babur padşah məiyyəti və ordusu ilə birlikdə Kabilin yolunu tutub şəhər ətrafında dayandı. Əmir Zünnun Ərğunun oğlu Məhəmməd Müqim şəhərdə möhkəmləndi. Kabil sakinləri padşaha mülazimlik etməyə meyil göstərdilər. Məhəmməd Müqim çarəsiz qalıb əhd-peymandan sonra Kabildən çıxdı və büsatı öpmək şərəfinə nail olub Qəndəhara yollandı. Babur padşah Kabili ələ keçirib rəiyyətin halını yaxşılaşdırmağın qayğısına qaldı.

Həmçinin bu il Bədiüzzaman mirzə, Əmir Xosrovşahla və Əmir Zünnunla ittifaqda Herata yönəldi. Cahanara bağında[1657] iki uğurlu ulduzun qovuşması və günəşlə ayın görüşməsi (yəni Sultan Hüseyn mirzə ilə Bədiüzzaman mirzənin görüşü) baş verdi. Bir neçə gündən sonra [Bədiüzzaman mirzə] Sultan Hüseyn mirzədən rüxsət alıb Mürğab çayı kənarına yollandı.

### Müxtəlif əhvalatlar

Bu il Karkiya Sultan Həsən öz qardaşı olan Gilan padşahı Karkiya Mirzə Əliyə yağı olub, Karkiya Mirzə Əlinin səltənətinin sütunu (“rüknüssəltənə”) olan Karkiya Fəridunu Sələndrudda[1658], Deyləman hüdudunda qətlə yetirdi. Karkiya Mirzə Əli səltənəti Sultan Həsənə təhvil verib özü ibadətlə məşğul oldu.

Həmçinin bu il Rum padşahı Sultan Bayəzid ibn Sultan Məhəmmədin elçisi İraqın və Farsın fəthini təbrik etmək üçün dünyanın pənahı olan xaqanın dərgahına gəldi, layiqli töhfələr və müvafiq peşkəşlər gətirib əlahəzrətə (Şah İsmayıla) təqdim etdi. O həzrət, Sultan Bayəzidə münasibətdə məhəbbətini izhar edib, elçini xələtlərlə və hörmətlərlə şərəfləndirərək yola saldı.

### Ölümlər

Məhəmməd Kərrə, Ağqoyunlu sultanları zamanında Əbərquh daruğası idi[1659]. İsgəndər şanlı xaqanın Şiraz üzərinə getdiyi vaxt o, aləmin pənahı olan dərgaha töhfələr və hədiyyələr göndərdi və əlahəzrət hökmdar Əbərquh hakimliyini ona lütf etdi. [Lakin] axırda o, müxaliflik edib, [yuxarıda] bəhs edildiyi kimi, İsfahanda yandırıldı.

Mövlana Hüseyn Vaiz[1660] bu il axirət aləminə köçdü. O, nücum elmində və inşada öz zəmanəsinin öndəgedəni idi. Digər elmlərdən də bəhrələnmişdi. “Cəvahirül-təfsir” (“Təfsir cavahiratı”), “Rövzətüş-şühəda” (“Şəhidlər bağçası”), “Ənvari-Süheyli” (“Süheyl nurları”), “Əxlaqi-möhsini” (“Comərdlik əxlaqı”), “Məsabihül-qülub” (“Qəlblərin çıraqları”), “İxtiyarat”, “Məxzənül-inşa” (“İnşa xəzinəsi”) kimi əsərlər şiə Mövlana Hüseyn Səbzəvarinin əsərləridirlər. Mövlana Hüseyn Vaizin digər əsərləri də var.

---

[1657] Heratda Əmir Teymur tərəfindən salınmış bir bağ idi *(Seddon, şərhlər, s.232).*

[1658] Məclis nüsxəsi: “Şərəndaz”; Bakı nüsxəsi: “Sərandər”.

[1659] Məclis nüsxəsi: “Məhəmməd Kərrə, Ağqoyunlu sultanları zamanında Əbərquh daruğası Şeyxəli bəyi qovub Əbərquhun idarəçiliyini öz əlinə keçirmişdi”.

[1660] Din xadimi və alim Mövlana Kəmaləddin Hüseyn Vaiz Kaşifi Səbzəvari nəzərdə tutulur *(Nəvai, şərhlər, s.1008).*

Əlvənd bəy ibn Yusif bəy ibn Həsən padşah məğlubiyyətdən sonra bir müddət sərgərdan gəzdi. Ta o vaxtacan ki, Bağdada gedib oradan Diyarbəkrə yollandı. Orada Həsən padşahın qardaşı Cahangir bəyin oğlu Qasım bəylə Mardin hüdudunda döyüşüb, qalib gələrək səltənətə oturdu və bir neçə gün sonra vəfat etdi.

## 911-Cİ İLDƏ (04.06.1505 – 23.05.1506) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il İsgəndər şanlı xaqan Taromda qışlaq etdi. O, bəzi əmirləri Xalxal yolu ilə Rəşt padşahı Əmir Hüsaməddinin üzərinə göndərdi. Özü də mübarək vücudu ilə yağış damcılarından daha artıq sayda əsgərlərlə Tarom yolundan cah-calalla Rəştə gəldi. Əmir Hüsaməddin mələklərin yuva saldığı dərgaha bol töhfələr göndərdi. Dərgah müqərrəblərindən olan Şeyx Nəcməddin Rəşti Rəşt camaatına şəfaətçi olub onların günahının bağışlanmasını xahiş etdi. Onun xahişi qəbul edildi və rəştlilərin təqsirlərindən keçib geri döndülər.

### Xorasan vilayətində baş vermiş hadisələr haqqında söhbət

Bu il Şeybək xan ildırım əlamətli özbək qoşununun bir dəstəsini Meymənə və Faryaba basqın etməyə göndərdi və onlar həmin vilayətdə soyğunçuluq və qarətlə məşğul oldular. Ana tərəfdən nəsəbi Mirzə Baysunqura çatan və Sultan Hüseyn mirzənin mülazimi olmaqla şərəflənən Məhəmməd Qasım mirzə o hüdudda olan Əmir Şirəm Cəlairlə və Xoca Cəlaləddin Mirəkinin oğlu Əmir Babaxanla[1661] ittifaqda özbəkləri dəf etməyə yönəldi. Tərəflər arasında dava və qırğın baş verdi. Özbəklər zəfər qazandılar. Həmin üç əmir qətlə yetirildi. Bu xəbər Herata çatdıqda Sultan Hüseyn mirzə Cahanara bağında qışlaq etməyi münasib bilmədi, şəhər bağına gəlib orada məskən saldı və Xoca Şəmsəddin Məhəmməd Münşini Bədiüzzaman mirzənin yanına göndərdi ki, onu Herata gətirsin.

Bədiüzzaman mirzə şəhərə yollanıb Əmir Əlişirin mənzilində qaldı. Baharda Sultan Hüseyn mirzə on iki min döyüşçü[1662] ilə Mavəraünnəhrə yürüş əzmi ilə şəhər bağından hərəkət etdi və Bədiüzzaman mirzəni mənqəlay [təyin] etdi. Baba-İlahi[1663] mənzilinə yetişdikdən sonra padşahın zəifliyi o dərəcəyə çatdı ki, yola davam edə bilmədi. Bədiüzzaman mirzənin yanına adam göndərib onu öz hüzuruna çağırdı. Mirzə Bədiüzzaman üç yüz[1664] nəfər mülazimlə birlikdə atasının hüzuruna yetişib, sultanı olduqca zəif halda görərək qəmgin oldu.

### Müxtəlif əhvalatlar

Həmçinin bu il İsgəndər şanlı xaqan hökm etdi ki, Sultan Heydərə qarşı savaşa düşmənlərlə birlikdə getmiş hər kəsi qətlə yetirsinlər və bu işin araşdırılmasını o zaman qorçubaşı[1665] olan Abdal bəy Dədəyə tapşırdı. Bu səbəbdən çox adam qətlə yetirildi.

### Ölümlər

Bu il Sultan Hüseyn mirzə ibn Mirzə Mənsur ibn Mirzə Bayqara ibn Mirzə Ömərşeyx ibn Sahibqiran Əmir Teymur Kürəkan düşənbə günü, zilhiccə [ayının] 11-də[1666] (05.05.1506) Baba-İlahi mövqeyində vəfat etdi. Alim, adil, aqil, səxavətli və rəiyyətpərvər bir padşah idi. Alimlərə olduqca çox hörmət və izzət göstərərdi. Onlar üçün Heratda bir mədrəsə tikdirmişdi ki, aləmdə onun misli yoxdur. Səltənəti zamanında Heratda təxminən on min elm tələbəsinə təqaüd verilirdi. Onun məclisi əksər vaxtlarda elmi bəhslər və şeir söylənməsi ilə keçərdi. Ali imarətlərin əsasını qoyub onları tamama yetirmişdi. Bunlardan biri Murad bağıdır[1667] ki, İrəm [bağı] onun bir nümunəsidir. Onun əmirləri də Heratda ali imarətlər tikdirmişlər. Səltənəti əyyamında təqribən iyirmi il iflic olmuş, nə yeriməyə, nə də ata minməyə gücü olmamışdır. Həmişə onu dörd nəfər təxti-rəvana qoyub özünün istədiyi yerə aparırdılar. Amudərya çayı kənarından ta Damğana qədər [ərazilər]

---

[1661] Peterburq nüsxəsində “Babacan” *(Материалы по истории туркмен и Туркмении, Том II, с.53).*
[1662] Bakı nüsxəsi: “yaxşı silahlanmış on iki min süvari”.
[1663] Tehran nəşri: “Baba-Xaki”. Baba-İlahi – Badğis bölgəsindədir *(Seddon, şərhlər, s.232).*
[1664] Peterburq nüsxəsində “altı yüz” *(Материалы по истории туркмен и Туркмении, Том II, с.53).*
[1665] Qorçubaşı – şahın şəxsi qvardiyasının rəisi.
[1666] Tehran nəşri: “12-də”.
[1667] Murad bağı – Heratda Sultan Hüseyn Bayqara tərəfindən salınmış bir bağdır.

onun sərəncamı altında idi. Ömrünün müddəti yetmiş bir il, səltənət əyyamı otuz doqquz il olmuşdur. On dörd oğlu vardı: Fərrux Hüseyn mirzə, Şahqərib mirzə, Heydər Məhəmməd mirzə, Məhəmməd Məsum mirzə, İbrahim Hüseyn mirzə, Məhəmməd Hüseyn mirzə və Əbu-Turab mirzə - bunlar atalarının sağlığı dövründə ölmüşdürlər; Sultan Hüseyn mirzənin ölümündən sonra sağ olan [oğulları] bunlardır: Bədiüzzaman mirzə, Müzəffər Hüseyn mirzə, Köpək mirzə, İbnihüseyn mirzə, Əbül-Möhsün mirzə, Məhəmməd Qasım mirzə və Fəridun Hüseyn mirzə. Qız övladları isə on bir nəfərdir.

O həzrətin ölümündən sonra əmirlər və dövlət ərkanı Bədiüzzaman mirzəni müstəqil padşah etməyi münasib gördülər. Bəziləri dedilər ki, sikkəyə və xütbəyə Müzəffər Hüseyn mirzənin də adı daxil edilsin və bu yolla onun müxalifliyinin qarşısı alınsın. Bu barədə qalmaqal uzun sürdü. Müzəffər Hüseyn mirzənin anası Xədicəbəyim ağa böyük hörmət sahibi idi. Ona görə də şərikli hökmranlığa üstünlük verildi və cümə günü Herat məscidində hər iki şahzadə adına xütbə oxundu və sikkələrin üzərində onların ikisinin də adını nəqş etdilər. Ölkənin bölgələri və möhtərifəsi (vergiləri) ikisi arasında paylaşdırıldı və külli məmləkətdə olan hər şeyi öz aralarında tən yarı böldülər. Bundan xəbər tutan digər şahzadələr dedilər: "Əgər Bədiüzzaman mirzə müstəqil surətdə səltənəti idarə etsəydi, hamımız ona müti və tabe olardıq. Amma bir halda ki Müzəffər Hüseyn mirzə [ona] şərik olmuşdur, bizim üçün onların heç birinə tabe olmaq zəruri deyildir". Sonra hər biri hakim olduqları məmləkətdə öz adlarına xütbə oxutdular.

Gilan valisi Karkiya Mirzə Əli olduqca dindar və abid idi. Vaxtının çoxunu "Quran" oxumaqla, Allaha itaət və ibadət etməklə keçirərdi. Bu il Lahican camaatı əlbir olub Rankuh mövqeyində onu qətlə yetirdilər. Həyatının müddəti altmış dörd il, səltənət əyyamı iyirmi səkkiz il olmuşdur. Məmləkəti Biye-piş Gilanı idi[1668].

Elə həmin gün onun qardaşı Sultan Həsən də Rankuhda[1669] qətlə yetirildi. Bu xəbər şah ordusunda olan oğlu Karkiya Sultan Əhmədə çatdıqda İsgəndər şanlı xaqan onu bir dəstə qazi ilə Gilana göndərdi. Karkiya Sultan Əhməd Rankuh hüduduna çatdıqda atasını və əmisini qətlə yetirmiş əmirlər onu qarşılamağa çıxdılar. Onun ayağını öpmək istədikləri vaxt o, onların hamısını qətlə yetirdi və səltənətə sahib oldu.

### 912-Cİ İLDƏ (24.05.1506 – 12.05.1507) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il İsgəndər şanlı xaqan Xoyda qışlaq edib böyük əmirləri Kürd Sarim (Sarom) xanın üstünə göndərdi. Müzəffər ordu o azğın güruhun ölkəsinin həndəvərinə çatdıqda kürdlər asiman misallı dağların başlarına pənah apardılar. Qazilər onların məmləkətini qarət edib o imansız güruhdan bir çoxlarını amansız qılıncdan keçirdilər.

Bu əsnada xəbər çatdı ki, Sarim döyüşə hazır olub dağın ətəyinə gəlmişdir. Zəfər şüarlı əsgərlər o mərdimazarı dəf etməyə yönəldilər. Kürdlər də qarşıdurma və vuruşma qədəmi ilə irəli gəldilər. Olduqca çətin bir müharibə baş verdi və hər tərəfdən çox adam həlak torpağı üzərinə düşdü. Adlı-sanlı əmirlərdən Əbdi bəy Şamlu və Sarı Əli Möhürdar Təkəlü öldürüldü. Bayram bəy Qaramanlu və Xüləfa bəy hökmdarın ordusuna qayıtdılar.

#### Bədiüzzaman mirzə ilə Babur padşahın Şeybək xan üzərinə qoşun çəkməsi haqqında söhbət

Bu il Şeybək xan aman elini (ili-aman)[1670] Xorasan vilayətinə basqın etməyə göndərdi. Onlar Amudərya çayından keçib Mürğab kənarına qədər [əraziləri] tarac etdilər. O camaatın bir dəstəsi Mərvruddan keçib Badğisi də qarət etdi. O zaman Əmir Zünnun Ərğun, Əmir Sultan Bayəzid Barlası da özü ilə götürərək onların üzərinə sürətlə yürüş etdi. Özbək ordusu qələbənin bələdçilik etdiyi əsgərlərin hərəkətindən xəbərdar

---

[1668] Həmin zaman Gilanda iki əmirlik mövcud idi: mərkəzi Rəşt şəhəri olmaqla, Qızılüzən çayının sol sahilindəki Gilan ərazilərini əhatə edən Biye-pəs və mərkəzi Lahican olmaqla, Qızılüzən çayının sağ sahilindəki Gilan torpaqlarını əhatə edən Biye-piş əmirlikləri *(И.П.Петрушевский. Государства Азербайджана в XV веке, с.210).*

[1669] Rankuh – Lahicandan cənub-şərqdə yerləşir.

[1670] A.K.Arendsə görə, bu ifadə El Aman adlı sərkərdənin adıdır *(Материалы по истории туркмен и Туркмении, Том II, с.54).* Lakin fikrimizcə, həmin ifadəni "aman eli" kimi də mənalandırmaq mümkündür.

olub Zərdək çölünə[1671] tərəf qaçdı. Əmir Zünnun özünü onlara yetirib təqribən yüz nəfər özbəyi qətlə yetirdi və daha yetmiş nəfəri əsir edib geri qayıtdı.

O əsnada Mövlana Xətai, Şeybək xanın yanından elçi kimi Herata gəldi. O, şahzadələrə ərz etdi: "Şeybək xan deyir ki, həmişə sizin ata-babalarınız hadisələr baş verərkən bizim yüksək şanlı xanədanımıza pənah gətirmişlər. Münasib odur ki, siz də öz əcdadınızın qaydasına əməl edib müxaliflik qapısını bağlayasınız. Belə olarsa, məmləkətin ərazisi də abad qalar". Bədiüzzaman mirzə bilirdi ki, Şeybək xanın Mövlana Xətaini göndərməkdə əsl məqsədi Xorasanın vəziyyəti barədə məlumat almaqdır. Bu səbəbdən o, Mövlananı həbs etdirib, Xorasanın yan-yörəsinə qasidlər göndərərək şahzadələrin tolanması haqqında fərman verdi. Bu əsnada Məhəmməd Babur padşah məiyyəti və ordusu ilə Herata yollandı ki, şahzadələrlə ittifaq halında Şeybək xana qarşı vuruşsun. Bədiüzzaman mirzə və Müzəffər Hüseyn mirzə qarşılamağa çıxıb onu şəhərə gətirdilər və üç yüz tümən qəpiklə[1672] növbənöv hədiyyələri ona peşkəş etdilər.

Bu arada Bəlx valisi Əmir Sultan Qılıncaq[1673] tərəfindən elçilər gəlib ərz etdilər ki, Şeybək xan Bəlx şəhərini mühasirə etmiş və şəhərdə azuqə qalmamışdır. O həzrət (Bədiüzzaman mirzə) Məhəmməd Babur padşahla, onun qardaşı Cahangir mirzə ilə və Məhəmməd Qasım mirzə ilə birlikdə payızın əvvəllərində Heratdan Bəlxə doğru yola çıxdı. Əbül-Möhsün mirzə, İbnihüseyn mirzə və Mir Sultanəli Ərğun ardıcıl surətdə hökmdarın ordusuna birləşdilər. Köpək mirzə isə qardaşlarına qoşulmayıb, qeyri-mümkün istiqlal xəyalı ilə öz məkanında və məskənində, yəni İmam Rzanın müqəddəs Məşhədində qalaraq heç kəsi köməyə göndərmədi. Bu səbəbdən Bədiüzzaman mirzənin iradəsinə tam süstlük (ruh düşkünlüyü) yol tapdı. Əmir Zünnun ərz etdi:

- Cağatay ulusunun indi baş tutmuş bu birliyinin bir də müyəssər olması müşküldür. Fürsəti qənimət bilib özbəklərin üzərinə yeriməliyik.

Əmir Məhəmməd Bərəndüq Barlas isə buyurdu:

- Əgər biz Bəlxə yönəlsək, Köpək mirzə Herata gələcəkdir. Ailələri şəhərdə olan əksər əmirlər bizim yanımızdan fərar edib onun yanına gedəcəklər.

"Hadisənin əlacını baş verməzdən öncə görmək lazımdır,
İş əldən çıxdıqdan sonra heyifsilənməyin faydası yoxdur".

Dövlətə sərfəli olan odur ki, Herata qayıdaq və bu qışda evin içindəki (daxili) düşmənləri dəf edib, baharın əvvəllərində özbəkləri dəf etməyə tələsək.

O əsnada xəbər çatdı ki, Şeybək xan Bəlxi tutub Səmərqəndə tərəf yola düşmüşdür. Ona görə də cağatay qoşununun şüşə evinə təfriqə daşı dəydi. Babur padşah Kabilə yönəldi. Bədiüzzaman mirzə isə qışlaq etmək üçün Herata yollandı.

**Ölümlər**

912-ci ildə (1506-07) zamanın böyüklərindən və dövranın ariflərindən olan Əmir Seyid Hüseyni Lalə vəfat etdi. Zəmanə sultanları arzu-dilək başını onun astanasna sürtürdülər və onun ali xatirindən himmət diləyirdilər. Ölkələr tutan xaqan (Şah İsmayıl) da o yüksək şanlı seyidə münasibətdə lütfkarlıq məqamında idi. O, özünün Azərbaycandakı xilafətini (dini idarəçilik işlərini) adı çəkilən şəxsə həvalə etmişdi. [Əmir Seyid Hüseyni Lalənin] əsərlərindən biri təsəvvüf məsələləri haqqında dediyi mənzum "Risaleyi-məvahib"dir ("Bəxşişlər risaləsi"). Mövlana Cami həmin risalənin tərifi barəsində bu beytləri söyləmişdir:

"Tanrı adına nə yaxşı bəxşişlər xəzinəsi,
Taliblərin gözündə ali mətləblər.
Onda irfan[1674] sirləri şərh edilmiş,
Və ondan vicdan qapıları açılmış.
Allahın salamı olsun o kəsə ki,

[1671] Zərdək çölü və ya Dəşti-Zərdək – Heratla Amudərya arasında, Badğisin şimal hissəsində yerləşən bir çöldür.
[1672] "Küpüki" ("kəpəki") dinarlar termini monqol-tatarlar dövründən etibarən türk aləmində yayılmışdır. Hal-hazırda dilimizdə işlənən "qəpik" ifadəsi bu termindən yaranmışdır (daha ətraflı bax: *Seddon, şərhlər, s.233*).
[1673] Baroda nəşri: "Qıpçaq".
[1674] İrfan (ərəbcə: "bilmək", "xəbərdar olmaq") – Allahı dərk etmək mənasında işlədilən termin.

Onun peşəsi gövhərləri nəzmə çəkməkdir".

Bir başqa əsəri "Risaleyi-lətaifi-mənzum"dur ("Mənzum lətifələr risaləsi"). Digər bir əsəri ərəbcə [yazdığı] "Şərhi-füsusi-Şeyx Möhyəddin Ərəbi"dir ("Şeyx Möhyəddin Ərəbinin "Füsus" əsərinin şərhi")[1675]. O həzrətin daha bir əsəri "Risaleyi-mirat"dır ("Ayna risaləsi"). Başqa bir əsəri isə "Risaleyi-adabi-salikin"dir ("Sufi ədəb-ərkanına dair risalə"). Doğrusunu Allah bilir.

## 913-CÜ İLDƏ (13.05.1507 – 01.05.1508) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın Əlaüddövlə Zülqədərin üzərinə getməsi və o hünərsizin qaçması

Bu il xəbər gəldi ki, sultani dövlətin yağısı (düşməni) və Allah tərəfindən rədd olunmuş tüğyançı Əlaüddövlə Zülqədər qəzavü-qədərin gərdişindən tabeçilik yönündən və uzlaşma səmtindən saparaq üsyan yolunu tutmuş və tüğyan qapısını açmış, Sultan Muradla birləşib məmaliki-məhrusəyə[1676] hücum etmək iddiasına düşmüşdür.

Bu xəbər təsdiqini tapdıqda o həzrət (Şah İsmayıl) qalibiyyətli əsgərlərin hazır olması haqqında fərman verdi. Qısa zaman ərzində zəfərin varid olduğu orduda qeyri-məhdud sayda əsgər toplaşdı. Yayın əvvəllərində o, hərəkət bayrağını Əlbistana doğru yüksəltdi. Mənzilləri və mərhələləri qət edib, Sultan Bayəzidin ölkəsi olan Qeysəriyyə (Kayseri) ətrafından keçdi. Qələbə nişanlı əsgərlərdən o vilayətin sakinlərinə qarşı heç bir pis davranış baş vermədi.

Müqavimət gücünün olmadığını bilən Əlaüddövlə Əlbistandan fərar edib Durna dağına yönəldi. Ora elə bir dağdır ki, olduqca yüksəkdir, onun başı fələyin zirvəsinə çatır və onun üzərindən yer kürəsi zərrədən də kiçik görünür.

"Oranın pələngi şəfəq qanından şam yemiş,
Oranın ceyranı fələyin Oğlaq bürcündən kam almış.
Fələk yaşıllaşdırmış ətrafını,
Şəfəq bəzəmiş lalələrlə ətəyini.
Bir kəsin oraya yolu düşərsə,
Ayağı ağrıyar əqrəb tikanından".

İsgəndər şanlı xaqan Əlbistanda cah-calalla dayanıb Lələ bəyi bir dəstə qazi ilə Cahan (Ceyhan) çayının kənarına yolladı ki, oradan bir keçid yeri tapsın. Lələ bəy oraya gəlib, düşərgə salaraq əksər qaziləri arpa və saman axtarmaq üçün ətrafa göndərdi. O əsnada Əlaüddövlə Zülqədərin oğlu Sarı Qaplan cövşən geymiş igidlərdən [ibarət] bir dəstə ilə göründü. Lələ bəy az adamla onların qarşısına çıxdı. İki tərəf arasında qarşıdurma oldu və döyüş atəşi alovlandı. Zülqədər dilavərləri çox olduqları üçün qazilərə qalib gələrək Lələ bəyi atdan saldılar. O əsnada Xəlil ağa öz dəyərli canından əl çəkib öz atını Hüseyn bəy Lələyə verdi. Lələ bəy ata minib, özünü suya vuraraq çoxlu məşəqqətlə o coşqun dəryadan nicat sahilinə çıxmağı bacardı. Zülqədərlilər Xəlil ağanı üç yüz nəfər qazi ilə birlikdə qətlə yetirib geri döndülər.

Ağqoyunlu sultanları tərəfindən illərlə Diyarbəkr valisi olmuş Əmir bəy ibn Gülabi bəy ibn Əmir bəy Mosullu Əlbistan ətrafında qohumları və tabeçiləri ilə birgə İsgəndər şanlı xaqanın dərgahına gəldi. O həzrət onu hüsn-rəğbətlə qarşılayıb möhürdarlıq mənsəbini ona həvalə etdi.

Əlaüddəvlə İsgəndər şanlı xaqanla qarşılaşmadığı və müqavimət göstərmədiyi üçün o həzrət ona "Ala dana" ləqəbini verdi. Əzəmətli qazilər müxaliflərin ölkəsini yandırıb Xoya yollandılar. Yol əsnasında İsgəndər şanlı xaqana ərz etdilər ki, bu ətrafda Xarput adlı bir qala var; fitnəkar zülqədərlərdən və üsyankar fəsadçılardan [ibarət] bir dəstə orada sakindir və onlar qalanın möhkəmliyinə, azuqənin bolluğuna arxayın olub, xilaf bürcündə əyləşərək gəlib-gedənə zərər yetirirlər. Ali əmr verildi ki, o qala bir mərkəz kimi əhatəyə alınsın və qələbə şüarlı əsgərlər [oraya] yürüş etsinlər. Qala əhli əzəmətli qazilərin gücünü görüb müxalifliyi tərk etdi və itaət üzünü yerə qoyub İsgəndər şanlı xaqanın hüzuruna tələsdi. O həzrət həmin camaatın

[1675] "Füsus" – Şeyx Möhyəddin Ərəbinin "Füsusül-hikəm" ("Hikmətin daş-qaşları") adlı təsəvvüf haqqında əsəri nəzərdə tutulur.

[1676] Məmaliki-məhrusə – "qorunan məmləkətlər" mənasını verir və bu ad altında Səfəvilər dövlətinə tabe olan vilayətlər nəzərdə tutulur.

pislərini qətlə yetirib, yaxşılarına hörmət göstərdi və Diyarbəkr hakimliyini Xan Məhəmməd Ustacluya lütf edib onu həmin tərəfə yolladı.

Təəccüblüdür ki, "Tarixi-həbibüs-siyər"in[1677] müəllifi həmin zaman yaşamasına baxmayaraq, İsgəndər şanlı xaqanla Əlaüddövlə Zülqədər arasında üç günlük döyüşün baş verdiyini yazmışdır. Halbuki, [yuxarıda] qeyd edildiyi kimi, onlar heç qarşılaşmamışlar.

**Xan Məhəmməd Ustaclunun Sarı Qaplan Zülqədərlə müharibə etməsi haqqında söhbət**

Xan Məhəmməd hökmdar ordusundan ayrılıb Qara-Həmidə yollandığı zaman oranın hakimi olan Əmir bəy Mosullunun qardaşı Qayıtmış bəy müxaliflik izhar edərək şəhəri təslim etmədi. Ona görə də igid qazilər və cəsur dilavərlər səhrada (çöldə) qışlaq etdilər. Diyarbəkr kürdləri düşmənçiliyə başlayıb ordunun dörd bir yanına basqın etdilər və kimi gördülərsə, o biri dünyaya göndərdilər. Ərzaq tükənməyə başladı və axırda qətiyyən tapılmaz oldu. Qazilərin dolanışığının çətinliyini bilən Xan Məhəmməd kürdlərin düşərgəsi üzərinə yönəldi. Lakin kürdlər möhkəm bir yerdə idilər və onları ələ keçirmək müşkül idi. Ona görə də [Xan Məhəmməd] hərbi hiyləyə əl atıb, arxasını onlara çevirərək fərar etdi. Kürdlər qaziləri təqib etdilər. Elə ki düzənlik yerə çatdılar, Məhəmməd xan can odlayan ildırım kimi özünü onlara vurub kürdlərdən bir çoxlarını qətlə yetirdi və yaraladı. Kürdlər də qılınca və nizəyə əl uzadıb qiyamət əlamətli qoşunlardan neçə nəfəri yerə sərdilər. Axırda fəth və zəfər mehi Məhəmməd xanın burnunu ətirləndirdi. Kürdlər idbar üzlərini fərar vadisinə döndərdilər. Qazilər onları təqib edib təqribən yeddi min nəfəri qətlə yetirdilər. Onların mənzilindən (məskənindən) bol-bol mallar və ərzaqlar qazilərin əlinə düşdü. Soyğun və qarətdən sonra öz ordugahlarına tərəf qayıtdılar.

Bu arada xəbər çatdı ki, Həmid hakimi Qayıtmış bəy Əlaüddövlə Zülqədərin yanına adam göndərib, şəhəri ona təslim etmək üçün qoşun istəmişdir. Əlaüddövlə öz oğulları cümləsindən olan Qasım bəy Sarı Qaplanı və Ərdüvanə bəyi yaxşı silahlanmış on min nizədar süvari ilə göndərdi. Onlar zəfər nişanlı ordunun yaxınlığına çatdıqları vaxt Məhəmməd xan müxaliflərin yaxınlaşmasından əndişə dənizinə düşdü. O, qoşun başçıları ilə məşvərət qaydasını yerinə yetirdi. Böyüklərin və kiçiklərin hamısı belə qərara gəldilər ki, cəsur kişilərin həmlə küləyi ilə döyüş və vuruş alovlarını alışdırsınlar və düşmənlərin həyat xırmanını can odlayan nizənin şöləsi ilə yandırsınlar. Müşahidə zamanı [zülqədərlərin] çadırları az göründüyü üçün [ustaclular] elə təsəvvür edirdilər ki, onların adamlarının sayı azdır. Sübh çağı nurani günəş öz bayrağını qaldırdı və ulduzların qoşununu məğlub etdi.

Nəzm

"Səhər vaxtı bu mavi rəngli cila maddəsi,
Sübhün aynasından pası apardı.
Ulduzların şahı olan günəş göründü,
Sübhün aynasında bir surət kimi".

Məhəmməd xan Ustaclu ayağını üzəngiyə qoyub iki min nəfərlə zülqədər əsgərlərini qarşıladı. O, öz qardaşı Qara bəyi səkkiz yüz süvari ilə çərxçi [təyin] etdi, özü isə min iki yüz süvari ilə mərkəzdə yer tutdu. O tərəfdən Sarı Qaplan və Ərdüvanə bəy on min zülqədər süvarisi ilə hərb meydanına dəbdəbəli bir şəkildə gəldilər və qoşunu tərtib etməklə məşğul oldular. Sarı Qaplan öz adamlarının hamısını mərkəzdə cəmləşdirib bir anda ustaclu qoşununa hücum etdi. Onlar Qara bəyi cəmi çərxçilərlə birlikdə yəhərin üzərindən yerə saldılar. Çərxçi igidlər atdan düşmələrinə baxmayaraq, yerdən qalxıb zülqədərlərin atlarının sinəsinə qılınc vururdular. Bu əsnada Məhəmməd xan dilavərlərlə birlikdə yüyənlərini yüngül, üzəngilərini möhkəm edərək, əjdaha görkəmli nizələrini külək rəftarlı yeyin atlarının qulaqları üzərindən irəli uzadaraq, nərə çəkərək və "Allah, Allah" hayqırışlarını günəşə və aya çatdıraraq, mərkəzdən çıxıb özlərini zülqədərlərə vurdular. Onların atları bir-birinə dəydi. Yer buz bağladığından zülqədər qoşununun əksəriyyəti yerə yıxıldı. Belə ki, orada

1677 "Həbibüs-siyər" (tam adı: "Həbibüs-siyər fi əxbari-əfradül-bəşər", yəni "Bəşər fərdlərinə dair xəbərlər haqqında tərcümeyi-hal dostu") – Xandəmir ləqəbi ilə tanınan xorasanlı tarixçi Qiyasədin ibn Hüməməddin Məhəmmədin (1475/76-1535/36) 1524-cü ildə ilk variantını bitirdiyi və ümumi tarixə həsr etdiyi əsərdir. Əsərdə Səfəvi şeyxlərinin və I Şah İsmayılın tarixinə xüsusi diqqət yetirilmişdir *(Ч.А.Стори. Персидская литература, т. I, с.383-393; О.А.Эфендиев. Образование азербайджанского государства Сефевидов, с.15).*

olan bir dərə adam və atla dolmuşdu. Sarı Qaplan üç yüz nəfər zülqədərlə atdan düşmüşdü, lakin döyüşü davam etdirirdi. Xan Məhəmməd onu tanıyıb qoşununa hökm etdi ki, onu tutub yanına gətirsinlər. Ərdüvanə bəy də əsir alındı. Bu döyüşdə zülqədər camaatından yeddi yüz nəfər ad-san sahibi və otuz nəfər bayraq (ələm) yiyəsi əmir qətlə yetirildi. Sarı Qaplan elə ki Məhəmməd xanın yanına çatdı, onun ətəyinə düşüb xahiş etdi ki, "məni sağ-salamat İsgəndər şanlı xaqanın dərgahına göndərin". [Amma] o, [bu xahişi] qəbul etmədi. Axırda [Məhəmməd xan] bəzi adamların təhriki ilə [Sarı Qaplanı da] Ərdüvanə bəylə birlikdə qətlə yetirib onların başlarını ali dərgaha göndərdi. Qasid Xoy qışlağında özünü hökmdar ordusuna yetirdi və əhvalatı kama çatmış hökmdarın dərgahında ərz edib, ənama və ehsana qərq olaraq Diyarbəkrə tərəf geri döndü, şahın ona göstərdiyi böyük hüsn-rəğbəti ərz etdi.

Ondan sonra Xan Məhəmməd Həmid qalasını fəth etməyi qarşıya məqsəd qoydu. Əmir Qayıtmış daha bir neçə gün qalanı müdafiə etdi. Axırda şəhərin kələntəri Əhməd Çələbi yaxşı bəxtin yol göstərməsi ilə Əmir Qayıtmışdan üz döndərib bir bürcdən qaziləri yuxarı çəkdi. Əmir Qayıtmış əsir tutulub tamam əzab-əziyyətlə qətlə yetirildi. Xan Məhəmməd Həmiddə məskunlaşdı və o həşəmətli əmirin iqtidarının və şövkətinin şöhrəti Keyvan eyvanından keçdi. Əlaüddövlə Zülqədər həmin möhnətli xəbəri eşitdikdən sonra onun rüxsarının səhifəsinə göz ələyindən qan damlaları axdı və onun göz bəbəyi qan dəryası içində üzməyə başladı. Şahın güc və heybətinin səmum küləyi onun sinə sahəsinə və beyin ərazisinə zərər yetirdi, onun sümükləri zərgər sobasındakı qızıl və gümüş kimi əridi və damarlarındakı qan atəş üzərindəki şirə kimi cuşa gəldi (qaynadı).

**Şeybək xan Özbəyin Bədiüzzaman mirzə ilə müharibə etməsi haqqında söhbət**

Şeybək xan özünün Mavəraünnəhrin səltənət taxtında möhkəmlənməsindən və Babur padşahın Kabil tərəfə qaçmasından sonra həmişə Xorasan məmləkətini zəbt etməyi düşünürdü. Lakin Sultan Hüseyn mirzənin mövcudluğu səbəbindən onun bu niyyəti həyata keçmirdi. Nəhayət, Sultan Hüseyn mirzənin qaçılmaz [ölüm] hadisəsi baş verəndən sonra Şeybək xan Xorasanın tamahı ilə fələklərin dövrləri kimi nəhayətsiz və kainatın hadisələri kimi hədsiz bir qoşunla Kərki keçidindən keçdi. Həmzə sultan və Mehdi sultan Xüttəlan, Qunduz və Bağlan qoşunlarını cəmləyib xaqanın ordusuna qoşuldular. Şeybək xan Əndixud ətrafında dayandı. Bədiüzzaman mirzə tərəfindən o vilayətin hakimi olan Əmir Şahmənsur Əndixudu ona təslim etdi. O zaman Şeybək xan yağış damlalarından daha artıq sayda bir qoşunla şahzadələrin ordusuna tərəf sürətli yürüş etdi. O vaxta qədər xanın Amudərya çayını keçməsi xəbəri hələ tam təsdiqini tapmamışdı. Şeybək xanın Badğis nahiyələrinə gəlməsindən sonra Xorasan sultanları iztiraba düşdülər. Əmir Zünnun səhrada vuruşmağı münasib bildi. Əmir Məhəmməd Bərəndüq isə Heratda möhkəmlənməyi məsləhət gördü. Bu iki təklifdən birinə qərar verilməzdən öncə, pəncşənbə gününün səhər vaxtı, sözügedən ilin məhərrəm [ayının] 7-də (19.05.1507)[1678] Məhəmməd xan Şeybaninin asimani hadisələrdən daha çox sayda olan bir ordu ilə gəlib çatmasının əlamətləri göründü. O ordunun mənqəlayı olan Şeybək xanın oğlu Teymur sultan və Şeybək xanın qardaşı Mahmud sultanın oğlu Übeyd sağ və sol cinahları tərtib edib döyüş meydanına yetişdilər. Bədiüzzaman mirzə və Müzəffər Hüseyn mirzə ordunu hazırlamaqla məşğul olub savaş meydanına tələsdilər. Cəsur kişilər və hərb meydanının igidləri bir-birinə qarışıb qəhrəmanlıq və pəhləvanlıq göstərdilər. Atəşin tüstüsü öz nizəsini Keyvan eyvanına çatdırdı.

Şeir

"Qan tökən süngülər işə başladı,
Süngülərin tikanından çöl gülzar oldu".

O gün şücaət meşəsinin aslanı və igidlik dəryasının nəhəngi Əmir Zünnun ərğun [tayfasının] qoşunu ilə hiddətli bir şəkildə Mavəraünnəhr qoşunlarına həmlə edib onların bir qismini yaraladı və öldürdü. Lakin Səmərqənd ordusunun sayı hədsiz olduğu üçün onların köməyə göndərdikləri qüvvələrin sayı hər an artmaqda idi.

"Xorasan ordusu zəbun oldu,
Mərdlik meydanını tərk etdi".

---

[1678] Buradakı miladi tarix pəncşənbə (cümə axşamı) gününə deyil, çərşənbə gününə təsadüf edir.

Özbəklər güc gəldilər və Xorasan camaatı qaçış vadisinə üz qoydu. Əmir Zünnun bir dəstə igidlə birlikdə öldürüldü. Əmir Şeyxəli Toğayi bəzi tanınmış cağataylarla birlikdə əsir düşdü. Özbək ordusu qaçanları Toqquz-ribata qədər təqib etdi. Seyid Abdulla mirzə müqəddəs Məşhəddə Köpək mirzəyə qoşuldu. Əbdülbaqi mirzə və Əmir Məhəmməd Bərəndüq Barlas Səbzəvar hüdudunda İbnihüseyn mirzə ilə birləşdilər. Bədiüzzaman mirzə Qəndəhar tərəfə fərar etdi və Müzəffər Hüseyn mirzə Astarabad tərəfə tələsdi.

Şeybək xan Herata yönəldi. Əmir Cəmaləddin Mühəddis, Əmir Yusifin oğlu Əmir Qiyasəddin Məhəmməd və Heratın şeyxülislamı onu qarşılamağa tələsdilər. Onlar Kəhdəstanda xanla görüşüb şəhərə yönəldilər. Yasavullar ən qabaqda gedirdilər və deyirdilər:

- Söyləməyin ki, “Allah, Məhəmməd və Əli sənə yar olsun!”. Deyin ki, “Allah, Məhəmməd və dörd xəlifə sənə yar olsun!”.

Yaşlı bir müğənni qadın əlində bir dəf tutub xanın atının önündə gedir və bu rübaini oxuyurdu:

“Hər gün birisi qapıdan içəri girir ki, mənəm,
Özünü cahan sakinlərinə göstərir ki, mənəm.
Elə ki cahanın işi onun əlində qərar tutur,
Qəflətən əcəl qapıdan içəri girir ki, mənəm”.

Xanın əmri ilə o qadını döydülər və onun dəfini sındırdılar. Ondan sonra xan şəhərə daxil olub cümə məscidində namaz qıldı və hökm etdi ki, xütbədə onun adını “zamanın imamı” və “Allahın xəlifəsi” deyə söyləsinlər.

Bu məğlubiyyət xəbəri Köpək mirzəyə çatdıqda və Əbül-Möhsün mirzə də bunu eşitdikdə onlar qoşun toplamaqla və səf yaran bahadırları cəlb etməklə məşğul oldular. Şeybək xan Teymur sultanı və Übeyd sultanı döyüşkən qoşun və hiddətli ordu ilə müqəddəs Məşhədə yolladı. Köpək mirzə və Əbül-Möhsün mirzə düşmənlərin gəlişi xəbərini eşitdikdə əmirləri çağırıb məşvərət etdilər. Əmir Məhəmməd Vəli bəy ərz etdi:

- Məlum olur ki, Şeybək xan öz qoşununun əksəriyyətini bu tərəfə göndərmişdir və özü az adamla Kəhdəstan çəmənində dayanmışdır. Dövlətimiz üçün münasib olan budur ki, bir dəstə qoşunla işlək olmayan (qeyri-ənənəvi) bir yolla sürətli yürüş edərək, qəflətən üstünə hücuma keçib onu məğlub edək.

Bir sıra başqaları isə dedilər:

- Düşmənin çoxluğudan qorxmayaq və özbəkləri qarşılamağa tələsib onlarla vuruşaq.

Köpək mirzə və Əbül-Möhsün mirzə ikinci fikri qəbul edib, Übeyd xanla döyüşə hazırlaşaraq Məşhəd şəhərində qaldılar. Bu əsnada xəbər çatdı ki, özbək sultanları Türüqə[1679] gəlmişlər. Köpək mirzə və Əbül-Möhsün mirzə qoşunla şəhərdən çıxıb, sağ və sol cinahları tərtib edərək Məşhədlə Türüqün arasında indi Hövzi-Tuni [adı] ilə məşhur olan yerə çatdılar. Hər iki qoşunun dəstələri Əxzər dənizinin dalğaları kimi hərəkətə gəlib oxa, kamana, qılınca və nizəyə əl atdılar.

Şeir

“Qılıncın gücündən baş parçalandı,
Yarıq başdan göbəyə qədər içəri keçdi.
İgidlərin nizəsinin ucu sinəni yandırdı,
Qılınclar yırtdı, oxlar tikdi”.

Çalış-vuruşdan sonra Xorasan qoşunu məğlubiyyətə uğradı. Mavəraünnəhr ordusunun əsgərləri şahzadələri əsir edib Übeyd xanın qarşısına apardılar və hər ikisini qan tökən qılıncın zərbəsi ilə öldürdülər[1680]. Bu qoşunun qılıncdan qurtulanları Səbzəvarda İbnihüseyn mirzəyə qoşuldular. Übeyd xan və Teymur sultan hərəkət bayrağını Səbzəvara doğru yüksəltdilər. Düşmənlərin gəlişindən agah olan İbnihüseyn mirzə Düdər (“iki qapı”) ribatında qaldı. İki firqənin yaxınlaşmasından və iki tərəfin qarşılaşmasından sonra Xorasan ordusunun igidləri özbəkləri məğlub etdilər və Übeyd xanı yaralayaraq iqtidar bayrağını ucaltdılar. Amma Übeyd xan qaçanların önünü kəsib dedi:

- Ey igidlər, qaçmayın! Qoymayın ki, fərarilik utancının tozu sizin şərəf və namusunuzun ətəyinə qonsun və Şeybək xan sizi hüsn-rəğbət və iltifat nəzərindən salsın.

---

[1679] Türüq – Məşhəd şəhərinin iki fərsəx cənubunda yer adı *(Шараф-хан Бидлиси. Шараф-наме (перевод, предисловие, примечания и приложения Е.И.Васильевой). Т. 2, Москва, 1976, с.238; Seddon, şərhlər, s.235).*

[1680] Məclis nüsxəsi: “və o sitəmkar zalım qan tökən qılıncın zərbəsi ilə hər ikisini öldürdü”.

Elə ki özbəklər onun səsini eşitdilər, səksən nəfər [döyüş meydanına] dönməyi münasib bilib, “qayıtmaq yaxşıdır” kəlməsini dillərində əzbər edərək geri döndülər və İbnihüseyn mirzənin [qoşununun] mərkəzinə həmlə etdilər. Onların hücumu ucbatından cağatay qoşununun halına tamamilə sarsıntı yol tapdı. Buna baxmayaraq, Übeyd xana on altı zərbə vurdular. Bu zaman savaş dəryasının nəhəngi olan adlı-sanlı Bayaqu Bahadır öz əlini Übeyd xana sipər etdi. İbnihüseyn mirzə fəth və zəfərin surətini görməyə ümidvar olsa da, daha sonra mülkdən və maldan əl çəkib fərar vadisinə tələsdi. Əbdübaqi mirzə və Seyid Abdulla mirzə qətlə yetirildilər. Əmir Məhəmməd Bərəndüq Barlas əsir alındı. İbnihüseyn mirzə İraq və Azərbaycan tərəfə yönəlib, İsgəndər şanlı xaqanın ayağını öpmək şərəfinə nail olaraq əlahəzrət şahın qayğıkeşliyi və hüsn-rəğbəti ilə iftixarlı və başı uca oldu və xaqanın himayəsinin kölgəsi altında yer tutdu.

### Müxtəlif əhvalatlar

Rəbiüləvvəl ayının 10-da (20.07.1507) firənglər Hörmüzü istila etdilər. Oranın hakimi olan Turan şah oğlu Salğur şahın quru adından başqa heç nəyi qalmadı və o, Portuqal padşahına müti və tabe oldu.

Həmçinin bu il Şeybək xan Heratın daruğalığını nayman oymağından[1681] olan Canvəfa mirzəyə lütf etdi. Xanın bibisi oğlu Seyid Hadi Xoca müqəddəs Məşhəddə əyalət bayrağını yüksəltdi. Səbzəvar vilayəti Zinəş Bahadıra verildi. Qənbər bəy Mərvdə məskunlaşdı. Rahi bəy Baxərzdə hakim oldu. Babur padşahın bacısı oğlu Xürrəmşah sultan Bəlxi idarə etməyə getdi. Qənbər mirzə Kükəltaş da onunla birlikdə yola düşdü. Səmərqənd səltənəti Şeybək xanın oğlu Teymur sultana tapşırıldı. Übeyd xan isə əvvəlki kimi Buxarada sakin oldu.

Həmçinin bu il Əmir Sultanəli Ərğun və Əmir Zünnunun oğlu Əmir Şüca bəy, Şeybək xanın dərgahına bol peşkəş göndərib sədaqət və itaətlərini izhar etdilər.

Yenə bu il, qış vaxtı Şeybək xan Mavəraünnəhrə yönəlib Qiyasəddin Məhəmməd, Seyid Sədrəddin[1682] Yunis və Qazı İxtiyarəddin Həsən[1683] kimi Xorasan əyan-əşrəfini özü ilə apardı və onlara tam hörmət göstərdi.

Yenə də bu qışda Sultan Hüseyn mirzənin oğlu Məhəmməd Qasım mirzə qoşun yığıb müqəddəs Məşhədin üzərinə gəldi. Seyid Hadi Xoca müqavimət göstərə bilməyib Mərvə tərəf qaçdı. Şeybək xan bunu öyrəndikdən sonra həmin hadisəni dəf etməyi Übeyd xana tapşırdı. Übeyd xan Çaharcu[1684] keçidindən adlayıb müqəddəs Məşhədə gəldi. Məhəmməd Qasım mirzə şəhərin divarları içində döyüşə başlayıb məğlub oldu. Onu ələ keçirib qətlə yetirdilər.

Həmçinin bu il Babur padşah zəfərə yaxın olan ordusu ilə Kabildən və Qəzneyndən Qəndəhara gəldi. Şüca bəy və Məhəmməd Müqim, padşahın qarşısına çıxıb döyüşdülər və məğlub oldular. Qəndəhar və Zəmindavər məmləkəti tamamilə Babur padşahın hakimiyyəti altına keçdi. O, Əmir Zünnun Ərğunun uzun müddət yığdığı xəzinələri öz əmirləri və ordu başçıları arasında bölüşdürdü və o vilayətin hakimliyini öz alinəsəb qardaşı Sultan Nasir mirzəyə həvalə edib qayıdış yüyənini Kabil tərəfə çevirdi.

Bu xəbəri eşidən Şeybək xan zəfər şüarlı ordusu ilə Qəndəhara yönəldi. Alinəsəb xan Zəmindavərdə dayandı. Şüca bəy və Əmir Məhəmməd Müqim çoxlu peşkəşlə onun hüzuruna tələsdilər. Fərmana əsasən, onlar Übeyd xanla birlikdə mənqəlay kimi yola düşdülər. Düşmənlərin gəlişindən xəbərdar olan Sultan Nasirəddin mirzə qalaya sığındı. Bədkirdar özbəklər qalanı dairə kimi əhatəyə aldılar. Xan cənabları əzəmət və səadətlə qala ətrafında dayandı. Sultan Nasir mirzə düşmənlərin qorxusundan Qəndəharı qoyub Kabilə tələsdi və Şeybək xana bir neçə at göndərdi. Şeybək xan da o diyarın idarəsini Əmir Zünnunun övladlarına tapşırıb Herata yönəldi və Əmir Zünnunun övladlarından hər biri o vilayətin idarəçilik işləri ilə məşğul oldular.

---

1681 Nayman oymağı uyğur türklərinin bir qoludur *(Seddon, şərhlər, s.236).*
1682 Baroda nəşri: “Səədəddin”.
1683 Baroda nəşri: “Hüseyn”.
1684 Çaharcu – indiki Türkmənistanın Amudərya çayı sahilindəki Cərco şəhərinin köhnə adı.

## Ölümlər

Əlaüddövlə Zülqədərin oğlu Sarı Qaplanın adı Qasım idi. Şücaətini vəsf etmək üçün ona Sarı Qaplan deyirdilər. Dəfələrlə Rum və Şam qoşunu ilə döyüşüb qalib gəlmişdi. Qeyd edildiyi kimi, o, Xan Məhəmmədin fərmanı ilə öldürülmüşdür.

Sultan Hüseyn mirzənin oğlu Müzəffər Hüseyn mirzə Şeybək xandan fərar edib Astarabada getdikdən sonra orada hərəkət bayrağını axirətə tərəf qaldırdı (öldü).

Həsən[1685] Bəsrinin oğlu Əmir Zünnun ərğun qəbiləsindən idi və Əbu-Səidin hakimiyyəti zamanında səltənət mülazimləri silkində idi. Qarabağ hadisəsindən[1686] sonra Əmir Zünnun Herata tələsib bir neçə gün Sultan Hüseyn mirzənin xidmətində vaxtını keçirdi. Amma umduğu qayğını görmədiyi üçün fərar etməyi qərara alıb, Sultan Hüseyn mirzə Yadigar mirzəni dəf etməyə yollandığı vaxt Xəbuşanın Yalquzağac [adlı yerindən] köhlən atının yüyənini Mavəraünnəhrə doğru yönəldib çapdı və Səmərqəndə gedib, Sultan Əhməd mirzədən hüsn-rəğbət görərək o diyarda qaldı. Ondan sonra tərxanlı və ərğunlu əmirlər arasında baş vermiş münaqişə səbəbindən yenidən Xorasana yönəldi və Sultan Hüseyn mirzə Qur və Zəmindavər əyalətini ona verdi. Əmir Zünnun 884-cü ildə (25.03.1479 – 12.03.1480) o tərəfə yollandı. Üç-dörd il ərzində neçə dəfə o camaatla müharibə edib bütün döyüşlərdə zəfər qazandı. Əmir Zünnunun zəfərləri barədə xəbər tutan Sultan Hüseyn mirzə Qəndəhar, Fərah və Saxur hakimliyini də ona verdi. Amma bir neçə il bəzi şahzadələri növbə ilə hakim adı altında Qəndəhara göndərdi. Axırda Əmir Zünnun istiqlal əldə edib Şalü-Məstunu[1687] zəbt etdi. O, Qəndəhar hakimliyini öz böyük oğlu Şüca bəyə verdi, Saxur və Tulək daruğalığını Əbdüləli xan Tərxana lütf etdi, Qur hakimliyini Əmir Fəxrəddinə tapşırdı, özü isə Zəmindavərdə sakin oldu. O diyarda ali imarətlər ucaltdı və Sultan Hüseyn mirzəyə qarşı müxalifliyə başlayıb Mirzə Bədiüzzamana qoşuldu. Mərəl döyüşündə Şeybək xanın qoşunu tərəfindən öldürüldü. O, olduqca ədalətli idi, [Allaha] itaət və ibadət vəzifələrini ciddcəhdlə yerinə yetirirdi.

## 914-CÜ İLDƏ (02.05.1508 – 20.04.1509) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın Bağdada qoşun çəkməsi

Bu il İsgəndər şanlı xaqan Xəlil Yasavulu Bağdada göndərdi. O zaman Bağdadın valisi Barik bəy Pornak idi. O, xaqanın [göndərdiyi] xələtin gəlişindən xəbər tutunca qarşılamağa tələsdi, şahın [göndərdiyi] tacı, xələti geyməklə başı uca olub, özünün bütün adamlarına tac (qızılbaş tacı) geyindirdi və ali taxtın ətəyində dayananlar üçün padşahanə peşkəşlər hazırladı. O, həmin misilsiz malları Əbu-İshaq Şirəçi ilə fələyə bənzər taxtın ətəyinə göndərdi. Həmədanda töhfələr zəmanə xaqanının şərəfli nəzərinə çatdırıldı və bəyənildi. Əbu-İshaq icazə alıb Bağdada yönəldi. İsgəndər şanlı xaqan Əbu-İshaq Şirəçinin getməsindən sonra hərəkət bayrağını Bağdada tərəf yüksəltdi.

Şeir

“Axmağa başladı dəniz kimi şövkətli sel,
Onun qarşısında bir idi səhra ilə dağ.
Yollandı Bağdada böyük bir ordu,
Bütün yer üzü oldu şah yolu”.

Şərəfli padşahın hərəkətindən xəbər tutan Barik Pornak müxtəlif çətinliklərə baxmayaraq, Hələb tərəfə qaçdı.

Şeir

“Pis niyyətli qaçdı onun avazəsindən,
Darvaza önündə dava etmədi”.

---

[1685] Digər bir versiyaya görə: “Hüseyn” *(Nəvai, şərhlər, s.1029).*

[1686] Teymuri hökmdarı Əbu-Səid Azərbaycana yürüş edərkən Qarabağda qışlamaq istəmiş, lakin bacarmamışdır və Uzun Həsən tərəfindən məğlub edilərək öldürülmüşdür. Burada “Qarabağ hadisəsi” adı altında Əbu-Səidin Uzun Həsənə məğlub olmasına işarə edilir.

[1687] Şalü-Məstun (Şal və Məstung) – Bəlucistanın bölgələridirlər *(Seddon, şərhlər, 237).*

O həzrət cəmadiülaxır [ayının] 25-də (21.10.1508) cah-calalla Bağdada daxil oldu. Qəzavü-qədər kimi cərəyan edən fərman verildi ki, pornak camaatını həlak vadisinə çatdırsınlar. Ali məqamlı qazilər həmin ordunun çoxunu qətlə yetirdilər və Barikin bir quyuda həbs etdiyi İraqi-Ərəbin kübar seyidlərindən olan Seyid Məhəmməd Kəmunəni məhbusluqdan xilas etdilər. Nəcəfi-Əşrəfin touliyyətini İraqi-Ərəbin bəzi şəhərlərinin idarəçiliyi ilə birlikdə ona lütf etdilər. Bağdad əyaləti isə ətrafı ilə birlikdə divan əmiri (əmiri-divan) Xadim bəyə həvalə edildi və ona "xəlifətül-xüləfa" (xəlifələr xəlifəsi) ləqəbi verildi.

Cah-calallı [şahın] qulağına çatdı ki, o hüdudda bir meşə var, orada bir aslan məskən tutub və o vilayətin əhalisinə ondan müxtəlif zərərlər dəyib. Heç kəsin o ətrafdan və o çevrədən keçməyə və getməyə macalı yoxdur. O zərərli vəhşinin öldürülməsi üçün cəsarət meşəsinin aslanlarından və şücaət dəryasının nəhənglərindən hər biri aslan ovlayan xaqandan rüxsət istədilər. [Amma] o həzrət qəbul etmədi və özü şəxsən nəfis vücudu ilə o vəhşinin yaxınlığına gedərək bir oxla o igid aslanı həlak torpağı üzərinə sərdi.

Beyt

"Fəğan qalxdı asimandan və yerdən ki,
Əlinə və qoluna afərin olsun!"

Ondan sonra [şah] Hüveyzəyə yönəldi. O diyarın hakimi Sultan Fəyyaz Müşəşa o həzrətin hərəkətindən xəbər tutub, yüyənini çevirərək fərar etdi[1688]. O həzrət həmin məmləkətin əmirliyini ədalətli əmirlərdən birinə tapşırdı və oradan Dizfula yönəldi. O diyarın hakimi çoxlu hədiyyələrlə zəfər şüarlı xaqanın hüzuruna gəlib onun kimya kimi təsirli nəzəri qarşısına çıxdı. O zaman Şüştər valisi də layiqli hədiyyələrlə aləmin pənahı olan dərgaha gəlib hökmdarın hüsn-rəğbəti ilə qarşılaşdı. Bu arada Luri-Kuçek hakimi Məlik Rüstəm itaət və sədaqət kəmərini canının ortasına bağlayıb büsatı öpmək şərəfinə yetişdi və dostlara nəvaziş göstərən xaqan Xürrəmabad və Luri-Kuçek əyalətini onun bacarıqlı əllərinə tapşırdı. Bu işlərdən asudə olduqdan sonra [şah] qış vaxtı Şirazda qışlaq edib, baharda Azərbaycana yönəldi.

### Xan Məhəmməd Ustaclunun Kor Şahrux Zülqədərlə savaşı haqqında söhbət

Baharda güllər sultanı həşəmət və zinətlə bitkilər ulusuna basqın etməyə üz tutdu və öz tikanının oxu ilə qış qoşunlarını gülzar sahəsindən qovdu.

Şeir

"Buludun kosundan gurultu qalxdı,
Bitkilər ordusu cuşa gəldi.
Bulud öz üzünü qırışdırdı,
Dava üçün Rüstəm kimi kamanlar çəkdi.
Çiçək budağı bayraq qaldırdı,
Bitkilər tərtib etdilər qoşunlarını.
Jalədən onların başı islandı,
Ətəyinə çəkdi hər tərəfin daşını bulud".

Xan Məhəmməd Ustaclu Mardin yaylağına gəldi və öz qardaşı Qara bəyi Cəzirəyə basqına göndərdi. Qara bəy fərmana uyğun olaraq, soyğun və qarət mərasimini yerinə yetirib, imansız kürdlərdən bir çoxlarını amansız qılıncdan keçirərək çoxlu qənimətə yiyələndi və Mardinə xanın ordusuna qoşuldu.

O əsnada Əlaüddövlə Zülqədər [əvvəlki] döyüşə görə intiqam almaq üçün əzəmətli ordu və çoxsaylı qoşun cəmləyib onları özünün iki oğlu – böyük oğlu Kor Şahrux və kiçik oğlu Əhməd bəylə birlikdə Xan Məhəmməd Ustacluya qarşı müharibəyə göndərdi ki, Sarı Qaplanla Ərdüvanə bəyin qanını alsınlar. Xan adı çəkilən yaylaqda bu xoşagəlməz xəbəri eşidib Həmidə gəldi və hər biri igidlik meydanında Rüstəm və İsfəndiyarla bərabər dayanan üç min əzəmətli süvari ilə zülqədər qoşununun qarşısında səf qurdu. O tərəfdən Kor Şahrux və Əhməd bəy on bir min süvari ilə döyüş meydanına gəldilər. Səflər tərtib olunarkən, qılıncların işə düşməsindən öncə hər iki qoşunda olan tazi və tula itləri səflər arasında bir-biriləri ilə mücadilə etdilər. Ustaclu qoşununun itləri zülqədər itlərini qovaraq onların qoşununun mərkəzinə çatdılar. Qazilər nadir təsadüf-

[1688] "Həbibüs-siyər"ə görə, Şah İsmayılla Sultan Fəyyaz arasında döyüş baş vermiş və bu döyüşdə Sultan Fəyyaz öldürülmüş, Şah İsmayıl qalib gəlmişdi *(Nəvai, şərhlər, s.1033).*

lərdən olan bu halı müşahidə etdikdə fəth və zəfərin surətini görəcəklərinə ümidvar oldular. İlk öncə zülqədər qoşunu savaş və döyüş tozunu qaldırmağa başlayıb, qələbə nişanlı qoşunun mərkəzinə yaxınlaşaraq hərb alətlərini işlətməyə hazır oldu. Xan Məhəmməd qütb kimi vüqar ayağını qərar mərkəzində öz dövlətinin əsası (bünövrəsi) kimi möhkəm tutdu. O hökm etdi ki, zəfər aqibətli əsgərlər döyüş atlarını meydanda irəliyə aparmasınlar və öz dayandıqları yerdən hərəkət etməsinlər. Elə ki zülqədərlər həmin dilavərlərə çatdılar, "Və ürəklərinə qorxu saldı"[1689] kəlməsinə uyğun surətdə mətin qazilərin əzəmətindən qorxub, öz atlarının cilovunu çəkərək heyran qaldılar. Ondan sonra ustaclu bahadırları cəsarət əllərini igidlik qolçağından çıxarıb hamısı birdən onlara hücum etdilər, bir çoxlarını atdan saldılar və yer üzünü öldürülənlərin qanından Bədəxşan ləli kimi qırmızı (gülgün) etdilər.

Şeir

"Dəbilqələr qırmızı (gülgün) cam oldu,
Dikbaşların qırmızı meyi qan oldu.
Cahan başda-başa qan dənizi oldu,
Onun dalğasından fələk tərsinə dönmüş gəmi oldu".

Qazilərin hücumunu görən zülqədərlər idbar üzlərini fərar səmtinə çevirdilər. Qələbə şüarlı ordu onları təqib edib zülqədərlərdən bir çoxlarını qətlə yetirdi. Əsir düşmüş mötəbər şəxslər arasında Kor Şahrux, Əlaüddövlənin oğlu Əhməd bəy, Əziz ağanın oğlu Məhəmməd bəy, oymaqların əmirlərindən əlli nəfər[1690], Murad bəy, Ürkməz bəy və Qayıtmış bəy vardı. Ürkməz bəylə Qayıtmış bəyi sağ saxladılar. Digər üç nəfəri isə qətlə yetirib onların başlarını həmin iki nəfərlə İsgəndər şanlı xaqanın dərgahına göndərdilər. Həmin zaman o həzrət (Şah İsmayıl) Xoy qışlağından İraqi-Əcəmə doğru yolda idi. Xan Məhəmmədin mülazimi Həmədanda düşmənlərin başları və əsirlərlə birgə mələklərin yuva saldığı astanaya çatıb döyüşün gedişini məruzə etdi. İsgəndər şanlı xaqan, Ürkməzi azad edib onu özünə mülazim etdi və Xan Məhəmməd üçün zərlə tikilmiş tac və daş-qaşla bəzədilmiş qılınc kəməri göndərdi.

Əlaüddövlə Zülqədər bu xəbəri eşidəndən sonra göz fəvvarəsindən yaş damcıları axıtdı və qara keçə geydi. Onun əmirləri də çiyinlərinə palaz saldılar və elə bir təziyə saxladılar ki, beləsi heç bir zamanda baş verməmişdi. [Əlaüddövlə] bildi ki, bundan artıq Diyarbəkr məmləkətinə tamah salmaq həvəngdə su ovmağa və soyuq dəmiri döyməyə bənzəyir.

### Şeybək xan Özbəyin Astarabada gəlməsi və Bədiüzzaman mirzənin qaçması haqqında söhbət

Bu il Şeybək xan çayı keçib Astarabada yönəldi. Düşmənlərin yaxınlaşdığından xəbər tutan Bədiüzzaman mirzə öz oğlu Məhəmməd Zaman mirzəni Damğan qalasında əmisi Fəridun Hüseyn mirzənin yanında qoyub bol kədərlə İraqa və Azərbaycana yollandı. Şeybək xan Astarabad əyalətini Xoca Əhməd Qünqürata həvalə etdi.

Elə ki xanın zəfər ayətli bayraqlarının ayparası son dərəcə həşəmət və səadətlə Damğan üfüqündən doğdu, o şəhərdə olan Məhəmməd Zaman mirzə, Fəridun Hüseyn mirzə və b. əmirlər qalada müdafiə olunmağa qərar verdilər. Qaragün özbəklər həmin gün qalanı dairə kimi əhatəyə alıb qarşıqa və çəyirtkə kimi şəhərə üz qoydular. Neçə gündən sonra şahzadələr xanın hüzuruna elçilər göndərdilər və aman istədilər. Əhdpeymandan sonra onlar xanın dərgahına tələsib hüsn-rəğbət və şəfqətlə qəbul edildilər. Mirzə Məhəmməd Zaman Azərbaycana getməyə rüxsət aldı. Fəridun Hüseyn mirzə isə xanın icazəsi olmadan Ətrək çayı tərəfə, yaka türkmənlərinin[1691] arasına getdi. Şeybək xan Bistam vilayətindən ta Türküstanın sonuna qədər [əraziləri] ələ keçirdi. Yayda müqəddəs, şanlı və pak Məşhəd mahalına daxil olan Radkan çəmənində (Üləngi-Radkan) yaylaq etdi, qışda isə Mavəraünnəhrə tələsdi.

---

[1689] *Qurani-Kərim, "Əhzab" surəsi, 26-cı ayə.*
[1690] Bakı nüsxəsi: "qırx səkkiz nəfər".
[1691] Yaka türkmənləri ("sahil türkmənləri") – Xəzər dənizinin cənub-şərq sahilində, indiki Türkmənistan ərazisində və İranın həmsərhəd ərazilərində yaşayan türkmənlər.

### Müxtəlif hadisələr

Bu il İsgəndər şanlı xaqan əmirülüməralıq mənsəbini Şeyx Nəcm Zərgərə lütf etdi və onun möhürünü ali divanda bütün möhürlərdən daha yuxarıda vurdular.

Həmçinin bu il Bədiüzzaman mirzə özbək qoşununun təhlükəsindən fərar edib İsgəndər şanlı xaqanın dərgahına gəldi. O həzrətin fərmanına əsasən, Bayram bəy Qaramanlu onu qarşılayıb behişt ayinli məclisə gətirdi. Bədiüzzaman mirzə zati-alilərinin (Şah İsmayılın) əlini öpmək şərəfinə nail olub münasib bir yerdə qərar tutdu və şahın qayğısı və sayğısı sayəsində başı uca oldu.

### Ölümlər

Əlaüddövlə Zülqədərin oğlu Kor Şahruxun gözləri görmə qabiliyyətindən məhrum idi. Onun korluğunun səbəbi bu idi ki, 894-cü ildə (05.12.1488 – 24.11.1489) Budaq[1692] bəy Zülqədəroğlu Rum padşahı Sultan Bayəzidin yanına gedib ondan qoşun almış və Şahrux bəyin üstünə gecə basqını edib, onu əsir edərək gözlərinə mil çəkdirmişdi.

Əlaüddövlə Zülqədər intiqam üçün Rum ordusu ilə böyük bir hərb etdi və Budaq bəy qaçdı. Ondan sonra [Əlaüddövlə] rumilərin sərdarı olan Mixaloğlu İsgəndər bəyi əsir alıb Misir padşahı Sultan Qansunun yanına göndərdi. Nadir təsadüflərdəndir ki, ustaclu qoşunu arasında bir kor vardı və daim Tanrıya yalvarıb deyərdi ki, "İlahi, o koru bu korun əsiri et!". [Daha öncə] bəhs etdiyimiz döyüşdə Kor Şahrux həmin korun əlində əsir oldu.

Həmçinin bu il Əmir Zünnun Ərğunun oğlu Məhəmməd Müqim Qəndəharda təbii əcəllə vəfat etdi.

## 915-Cİ İLDƏ (21.04.1509 – 09.04.1510) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın ikinci dəfə Şirvana getməsi

Qışın ortasında soyuğun şiddətindən yerlə göy arasında yağış damlalarının ümman inciləri kimi donurdu və ördək (su quşu), əgər bacarardısa, özünü kabab quşu ilə bir şişə çəkib canından keçərdi.

Şeir

"Ördək ürəyinin yanğısı ilə özünü kabab edir,
Hər harada Səməndər kimi ataş qoxusu alırsa.
Soyuq küləyin əsməsi ilə gözəllərin dodağı göyərir,
Ah bu soyuqdan ki, atəşin üzündən rəngi aparır".

Belə bir vaxtda cahan xaqanı hidayət ayətli bayrağını Şirvana doğru yüksəltdi. Ali məiyyət mənzilləri və mərhələləri qət etdikdən sonra Kür çayı kənarına çatıb, o həzrətin əmri ilə salınmış körpüdən keçdi. Şeyxşah ali məqamlı xaqanın hərəkətindən xəbər tutub Biqurd qalasına sığındı. Ondan sonra fələk şövkətli ordu Bakıya doğru hərəkətə gəldi. O qalanın kutvalı töhfələr və hədiyyələrlə aləmin pənahı olan dərgaha tələsib xüsusi ənamlara və xələtlərə layiq görüldü. Kama çatmış xaqan Bakıdan Şabrana getdi. O vilayətin valisi o həzrətin əzəmətindən və şövkətindən agah olduqda, uğurlu bəxt kimi onun qarşılamağa tələsib, tabeçilik örtüyünü çiyninə salaraq iltifatlı nəzərlə qəbul edildi. Ondan sonra o həzrət hərəkət bayrağını Dərbəndə doğru yüksəltdi. O, elə bir qaladır ki, olduqca möhkəmliyi ilə məşhurdur və son dərəcə mətanəti ilə ağızlarda və dillərdə əzbərdir. Onun fəzasının havasındakı quşlar Nəsri-tair[1693] ilə sirdaş və onun dərin xəndəyinin balıqları yer öküzü ilə yoldaşdır.

Şeir

"Qapısı İsgəndər səddi ilə əkiz,
Sanki göydən yerə enmiş bir bürcdür.
Küngürəsinin başı fələyə yol aparmış,
Olmuş günəş və ayın başı üstündə mişar.

[1692] Daha çox Şahbudaq adı ilə tanınmışdır.
[1693] Qərb tərəfdə görünən parlaq bir ulduz. Qartal bürcünün ən parlaq ulduzudur *(F.Devellioğlu. Osmanlıca-Türkçe ansiklopedik lugat (yeni ve eski harflerle). 24. baskı. Ankara, 2007, s.824).*

Təməli yetərincə yüksək olduğu üçün,
Düşməz kölgəsi fələyə, əsrlər keçsə belə”.

Qalibiyyətli qoşun qarşısı alınmaz qəza kimi o möhkəm qalanın ətrafında dayandı. Yar Əhməd ağa və Məhəmməd bəy öz oxları ilə Nəsri-Tairə xətər yetirə bilən və mətin dağı öz tüfənglərinin atəşi ilə qorxudan, ruzigarın istisini-soyuğunu hiss etmiş təcrübəli adamlardan [ibarət] bir dəstə ilə o qalada sakin idilər. Onlar ox və daş atmağa başladılar. Bu tərəfdən də dəmir pəncəli igidlər döyüşə atıldılar. Lağımçılar lağım vurmağa başladılar. O qalanın bürclərini ələk kimi dəlmə-deşik etdilər. Yar Əhməd ağa və Məhəmməd bəy anladılar ki, işləri çətindir. Nəhayət, səf yaran xaqanın dərgahına qılınc və kəfənlə tələsib şahanə hüsn-rəğbət nəzəri ilə şərəfləndirildilər və başı uca oldular. Sonra o həzrət Dərbənd hakimliyinin boyunbağısını Mənsur bəyin boynuna saldı və hökmdar tərəfindən hökm verildi ki, o vaxtadək Təbərsəranda basdırılmış olan övliyalar sultanı Sultan Heydərin cəsədini[1694] Ərdəbilə köçürsünlər. Xüsusi adamlardan [ibarət] bir zümrə həmin xidməti yerinə yetirməyi öhdəsinə götürüb, o həzrətin şərəfli cəsədini torpaqdan çıxararaq məhfəyə qoydular və böyük əcdadlarının məqbərəsində dəfn etdilər. Uzun zaman keçməsinə baxmayaraq, onun ürək açan lətif əzaları bir-birindən ayrılmamışdı. Daha sonra aləmin pənahı olan xaqan savaşdan əl çəkib, Kür çayını keçərək darüssəltənə Təbrizdə cah-calalla dayandı.

**Müxtəlif hadisələr**

Bu qışda Şeybək xan Kirmana basqın etmək üçün səhra yolu ilə böyük bir ordu göndərdi. Özbəklər o vilayətin bəzi yerlərini qarət edib, Kirman kələntəri Xoca Şeyx Məhəmmədi qətlə yetirərək Xorasana tərəf qayıtdılar.

Həmçinin bu il Şeybək xan İsgəndər şanlı xaqana bir məktub (kitabət) göndərdi. Orada bu beyti yazmışdı:

Şeir

“Xaraba İraq mülkünə tamahım yoxdur,
Gərək Məkkə və Mədinəni fəth edim!”

İsgəndər şanlı xaqan cavabında yazdı:

“Hər kim candan Əli Əbu-Türabın qulu deyilsə,
Yüz Məkkə və Mədinə tutsa da, əhəmiyyəti yoxdur”.

Həmçinin bu il Şeybək xan Dəşti-Qıpçaq padşahı Qasım xan tərəfindən məğlubiyyətə uğradılıb pərişan halda Xorasana gəldi. Ondan sonra dağlıq ölkə olan Zəmindavərdə yaşayan həzarə və nekudəri qövmlərinin[1695] üstünə qoşun çəksə də, bir iş görə bilmədi.

Həmçinin bu il, səfər ayında (21.05-18.06.1509) İsgəndər şanlı xaqan Qəzvin ölkəsinin və Rey Savucbulağının sahibi olan Abdal bəy Dədəni bu vəzifədən çıxarıb onun ölkəsini Zeynal bəy Şamluya lütf etdi və ona xan ləqəbi verildi. Böyük bir vəzifə olan sədarət mənsəbi Əmir Seyid Şərif Əllamənin qızının oğlu olan Əmir Seyid Şərif Şiraziyə şəriksiz surətdə tapşırıldı. Təbrizdə Hüseyn bəy Lələ əmirülüməralıqdan çıxarıldı və onun mənsəbi Məhəmməd bəy Süfrəçi Ustacluya həvalə edildi. [Sonuncuya] Çayan sultan ləqəbi verildi.

Yenə bu il ali divanda sədarət mənsəbini əmirliklə birləşdirən, nahaq qanlar tökən, cürbəcür pis əməllər törədən, Yəzdin, Kaşanın və İraq mahallarından bir xeylisinin hakimliyini icra edən və həmin vaxt Şiraz hakimliyini də yerinə yetirən Qazı Məhəmməd Kaşi, İsgəndər şanlı xaqanın fərmanı ilə qətlə yetirildi.

---

[1694] A.Bakıxanov şeyxin ilkin qəbrinin Təbərsərandakı Ətək mahalında, Rubas çayının sol sahilində, Tinid kəndindən 1 fərsəx aralıda olduğunu qeyd etsə də *(А.Бакиханов. Гюлистани – Ирам; редакция, комментарии, примечания и указатели З.М.Буниятова. Баку, 1991, с.93),* tədqiqatlar nəticəsində məzarın Xızı rayonunun Tıxlı kəndi yaxınlığında yerləşdiyi müəyyənləşdirilmişdir *(M.Nemət. Azərbaycanda pirlər, s.56).*

[1695] Həzarə – XIII əsrdə, monqol-tatar işğalları dövründə Monqolustandan gəlib Əfqanıstanda məskunlaşmış döyüşçülərin nəsillərindən törəmiş bir tayfadır. Onların ilk başçısı Nekudər-oğlan adlı monqol-tatar sərkərdəsi olmuşdur *(Seddon, şərhlər, s.238).*

### Ölümlər

Şeybək xanın Qasım xanın üzərinə getdiyini[1696] eşidən Sultan Hüseyn mirzənin oğlu Fəridun Hüseyn mirzə yaka türkmənlərindən ayrılıb Kəlat qalasını ələ keçirdi. Mərv hakimi Qənbər bəy özbək qoşunlarının bir dəstəsi ilə Kəlat üzərinə gedib, Fəridun Hüseyn mirzəni ələ keçirərək qətlə yetirdi.

İsgəndər şanlı xaqanın vəkili Nəcməddin Məsud[1697] Təbriz yaxınlığında olan Xəmnə[1698] mövqeyində vərəm xəstəliyindən vəfat etdi. Onun cəsədini qəzavü-qədər kimi cərəyan edən fərmana əsasən Nəcəfi-Əşrəfə apardılar. Onun mənsəbini İsfahan mahalından olan Əmir Yarəhməd Xuzaniyə lütf edib ona Nəcmi-Sani (İkinci Nəcm) ləqəbini verdilər. Mövlana Ümidi Tehrani onun adına bir qəsidə demişdir ki, bir neçə beytini [buraya] yazırıq:

Şeir

“Afərin cövhərinə ki, səmavi gövhərdir,
Sənsən birinci aqil, sənsən ikinci Nəcm.
Hərəm rəvaqının İraqi sütunu sənsən,
İraqi-Əcəmin Süheyli-Yəmanisi[1699] sənsən.
Qızılla işlənmiş, cövhərlə dolu qılıncını işə sal,
Çünki onun suyu ilə yox olur fitnəyə susamışlar.
Qılıncın su və atəşdən ibarət qəribə bir dəniz,
Örtük bağlayıb onun üzərində tüstü.
Cövhərinin necə də mahiyyəti var ki,
Həm suda yaşayır, həm də atəşdə”.

## 916-CI İLDƏ (10.04.1510 – 30.03.1511) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın Şeybək xanla müharibə etməsi

Şeybək xan Xorasan vilayətini istila etdikdən sonra İsgəndər şanlı xaqan həmişə onunla döyüşün və qarşıdurmanın nəqşini öz xatirinin lövhəsinə və öz könlünün səhifəsinə nəqş edir və çəkirdi. Amma müxtəlif hadisələr üzündən o niyyət xəyaldan gerçəkliyə çevrilmirdi. Nəhayət, bu il onun ali xatirində İraq, Fars, Kirman, Şirvan, Azərbaycan, Diyarbəkr və İraqi-Ərəb vilayətləri barəsində bir narahatlıq qalmadı. Eyni zamanda Şeybək xanın Xorasan, Bədəxşan, Mavəraünnəhr, Daşkənd və Türküstan üzərindəki istilası xəbəri təkrarən hökmdarın qulağına çatdı. Digər səbəb isə odur ki, Şeybək xan Şeybani hökmdarlıq xəyalını və kama yetmək arzusunu beynində yerləşdirmiş, yaxşı təbiətli sultanlara xas olan ədalət və insaf ayinini zülm və insafsızlıqla əvəz etmiş, fitnə-fəsad qapısını acizlərin və miskinlərin üzünə açmış, haqq imamiyyə məzhəbini və gözəl naciyyə firqəsini nəzərdə tutan “Bu, şübhəsiz ki, mənim doğru yolumdur, onu tutub gedin!”[1700] [ayəsinin] möhkəm yoluna və doğru yönünə zidd getmiş, cahangirlik məqsədini qarşıya qoymuş, ölkələri tutmaq niyyətinə düşmüş, hər gün vəhşət doğuran hekayələrlə münasibətləri gərginləşdirmiş, küdurət yaradan rəvayətlərlə elçilər və məktublar yollamış, dəfələrlə qeyri-məhdud qoşunlarının bir dəstəsini məmaliki-məhrusənin və vilayati-mənusənin[1701] hüduduna göndərmiş, səbəbsiz yerə təcavüzkarlıq əlini acizləri və miskinləri soymaq, talamaq və qarət etmək üçün uzatmış və [Şah İsmayıla] bir ədəbsiz məktub göndərmişdi ki, surəti burada təqdim olunur.

Məktub (kitabət)

“Sultanlığımızın sonsuz qayğısı ilə xüsusi şərəfə layiq görülmüş İsmayıl daruğaya bəlli olsun ki, məmləkət işlərini həll etmək, ölkələri fəth edib düşmənləri məhv etmək və insanlara xeyirli olan işləri çoxal-

---

[1696] “... üzərinə gedərək məğlub olduğunu” *(Материалы по истории туркмен и Туркмении, Том II, с.54).*

[1697] Məclis nüsxəsi: “Əmir Nəcm Zərgər Gilani”

[1698] Bu yer indi Xamnə kimi tanınır.

[1699] Süheyl – Şərq astronomiyasına görə, səmanın cənub yarımkürəsində olan Səfineyi-Nuh (Nuh gəmisi) bürcündə parlaq və böyük bir ulduzun adıdır. Yəməndən daha yaxşı göründüyü üçün buna “Süheyli-Yəmani” də deyirlər *(Cevan, şərhlər, s.136).*

[1700] *Qurani-Kərim, “Ənam” surəsi, 153-cü ayə.*

[1701] Məmaliki-məhrusə – “qorunan məmləkətlər”, vilayati-mənusə isə – “alışılmış (vərdiş edilmiş) vilayətlər” deməkdir. Bu adlar altında Səfəvilər dövlətinin tərkibinə daxil olan məmləkətlər və vilayətlər nəzərdə tutulmuşdur.

dıb hər yana yaymaq kimi çətin bir vəzifə Allahın mərhəməti ilə əzəldən mənim böyük və xoşbəxt əcdadımın – Allah onlara rəhmət eləsin və cənnət rahatlığı bəxş etsin – qüdrətli əllərinə tapşırılmışdır, ədalət və mərhəmət minbəri bizim dünyanın pənahı olan yüksək və adil hakimiyyətimizin xütbəsi ilə ucalmışdır, cəsarət və qalibiyyət zərbxanasında igidlik sikkəsi bizim xoşbəxt övladlarımızla kəsilmişdir, rəhbərlik sədası və xilafət nidası qeybdən bizə yetişmişdir. Həzrət peyğəmbərin – ona və bütün nəslinə salam olsun – buyurduğu: "Övlad – atanın varisidir" sözləri bunu təsdiq edir ki, atanın mirası oğula çatmalıdır, övladın buna haqqı var. Başqa bir əqli dəlil budur ki, qaranlıq gecədə göydə ulduzlar çıxar, o cümlədən Süheyl ulduzu həmişəki yerində - dağın zirvəsindən təqribən bir nizə ucalığında görünər; lakin Günəşin çıxmasının qorxusundan onun rəngi saralar və bir saat titrəyər, işıqlı səhər açıldıqda isə çıxdığı yerə enər. Beləcə, bizim Şərqdən zühurumuzu və özünün Qərbdən baş qaldırmağını Süheyl və Günəşin çıxması ilə müqayisə et!

Daha sonra, mübarək Məkkənin ziyarət edilməsi islamın başlıca ayinlərindən biri olduğu üçün bütün müsəlmanlar böyük Kəbəyə aparan yolları qaydaya salmağa borcludurlar. Bizim qalibiyyətli əsgərlərimiz ziyarət şərəfinə nail olmaq istəyirlər. Ona görə də töhfələr və hədiyyələr hazırlamalı, sikkələri bizim xoşbəxt adımıza zərb etdirməli, cümə məscidlərində bizim cahangir adımıza xütbə oxutdurmalı və özün bizim uca taxtımızın ayağına gəlməlisən. Yox, əgər bizim hökmümüzə - Allah onu "yer üzünün şərq və qərb tərəflərinə"[1702] yaysın – boyun əyməyib itaətsizlik göstərsən, səltənət və hakimiyyət çeşməsi, qələbə meydanının mübarizi, Səyavuş qüdrətli və Keykavus dəyanətli əziz və xoşbəxt övladı,

Şeir

"Cavan və cavanbəxt, qəlbi işıqlı,
Taledə cavan, tədbirdə qoca.
Bilikdə böyük, qüdrətdə uca,
Biləyi qüvvətli, ürəyi açıq",

Əbül-Mübariz İmadəddin Übeydulla xanı – Allah saxlasın onu – Buxara, Səmərqənd, Həzarə, Nikudəri, Qur və Qərcistan tərəflərinin əmirləri və qoşunu ilə sənin üstünə göndərəcəyəm və o, səni cəzalandırıb məhv edəcək. Əgər belə olmasa, onda başqa bir gənc övladım – zaman səltənətinin mücəssəməsi, əmin-amanlığın təminatçısı, küfr və özbaşınalığın kökünü kəsən, hansı tərəfə atını sürsə, məqsəd ölkəsini zəfər və qələbə ilə fəth edən,

Şeir

"Bəxt onun üzəngisinin həndəvərindədir, qələbə qarşısındadır,
Hər haraya üz tutsa, mələklər dəstəsi onun qoşunudur.
Dəryanın dibində timsah onun qılıncının şimşəyindən tutrəyir,
Onun əsgərlərinin qılınclarından meşələr aslansız qalıb",

Əbül-Fəvaris Teymur Bahadır xan – Allah onun ömrünü uzatsın – Qunduz[1703], Bəğlan, Hisari-Şadman, Bədəxşan və Türküstan ətrafına qədər olan vilayətlərin əmirləri və qoşunu ilə sənin üstünə gələcək ki, o ölkəni ələ keçirib bizim ixtiyarımıza versin. Yox, əgər Allah eləməmiş, bu dəfə də baş tutmasa, onda qələbə şüarlı bayraqlarla öz qoşunumuzu göndərəcəyik. Əvvəlcə əziz övladım, murad gülünün qönçəsi, canımın təsəllisi, ürəyimizin təpəri, hər yanda igidlik zərbinə görə döyüş meşəsinin aslanı kimi tanınan,

Şeir

"Nizəsinin zərbəsindən fələyin qəddi əyilib,
Cəmşid kimi iki yüz şah onun kəməndində əsirdir.
Döyüş meydanında qılıncını sıyırsa,
İtaətsizlərin başını qana bulayar",

Əbül-Nəsr Kəmaləddin Sevincək Məhəmməd Bahadır xana – Allah onu qorusun – bir dəstə əmir və yaxın adamlarla birlikdə bu işi həvalə edəcəyik və tacımın dürrü olan övladım, dövranın şücaətlisi, cəngavərlik Ceyhununun timsahı Həmzə Bahadır xan sağ cinahdan, məmləkətin gözü olan övladım, şücaəti ilə ölkələrdə tanınmış Səliməddin Mehdi Bahadır xan sol cinahdan, Əndican, Qəndi-Badam[1704], Şahruxiyyə, Daşkənd,

---

[1702] *Qurani-Kərim, "Əraf" surəsi, 137-ci ayə.*
[1703] Baroda nəşri: "Qəndəhar".
[1704] Qəndi-Badam – Xocənd yaxınlığında yerləşir *(Seddon, şərhlər, s.239).*

Şəhrisəba, Otrar, Seyran, Ürgənc[1705], Xarəzm[1706], Ceyhun sahilləri, Kaşğar və Mənqitdən[1707] tutmuş Qıpçaq və Qəlmaq ətrafına qədər yerləşmiş əmirlər, sərkərdələr və din əsgərləri ilə birlikdə üstünə yeriyəcək, düşmənlə vuruşacaq və bu zaman orada olan dövlət əyanları vüqarla qəhrəmanlıq meydanına qədəm qoyacaqlar. Allah-taalanın köməyi ilə "Allah sənə yenilməz qələbə verəcəkdir"[1708] xəzinəsindən qarşımıza qələbə çıxacaq. Elan edin ki, müqavimət yeriniz hansı məkan olacaqdır. Vəssəlam!".

Ona görə də həmin tərəfə hərəkət etməyə qərar verildi. Bəhram kimi güclü təvaçılar məmaliki-məhrusənin qoşunlarının toplanması üçün ətrafdakı şəhərlərə və vilayətlərə doğru hərəkətə keçdilər. Hamısı qılınc vuran və nizə atan, yağış sayı qədər əsgər (sipahi) hökmdar ordusuna cəmləşdi.

Şeir

"Hər biri yarın gözü kimi qılınc vuran,
Dildarın zülfü kimi başdan-başa səf yaran".

Qələbə nişanlı bayraqlar Sultaniyyə çəmənindən Rey tərəfə hərəkətə gəldilər.

Şeir

"O böyük ordunun hərəkətindən,
Dünya başdan-başa hərəkətə gəldi.
Atların həngamə çıxaran ayaq tozundan,
Torpaq pərdə çəkdi günün üzünə.
Məst olan aslanların hərəkətindən,
Yerin altındakı öküzün beli qırıldı".

Reydən köhlən atının yüyənini Damğan vilayətinə doğru çevirdi. O şəhərin hakimi Əhməd sultan Şeybək xanın[1709] kürəkəni idi. O, zəfər şüarlı əsgərlərin gəlişindən agah olduqda Herat tərəfə qaçdı. Astarabad hakimi Əhməd Qünqürat da fərar edib Xarəzm tərəfə getdi. Astarabadın say-seçmə adamlarından Seyid Rəfi, Baba Nodar və b. bol peşkəşlə Bistamda büsatı öpmək izzətinə qovuşdular. Cacərm bölgəsində Xoca Müzəffər Bitikçi [şahın] hüzuruna gəlmək şərəfinə nail oldu.

Şeir

"Müzəffərdir çərxi-fələkdən onun adı,
Kölgəsi zəfər olan hümay quşu onun toruna düşüb.
Şahın ayağını öpmək üçün başını yerə qoydu,
Bununla da başının qədr-qiyməti günəşlə aya yüksəldi.
Şah onun uğurlu adını yaxşı əlamət bildi,
Dedi ki, zəfər quşu bizim tərəfimizə qanad çalıb".

O tərəfdən Həzarə yürüşündən ürəyi yüz parçaya bölünmüş (qəmgin) halda dönən Şeybək xan Cahanara bağında olduğu zaman Əhməd sultan Herata çatıb ərz etdi:

- İsgəndər şanlı xaqan döyüş ahəngini kökləyərək Xorasana gəlmişdir. Əsgərləri o qədər çoxdur ki, ədəd və bəyan natiqləri onu saymaqdan təngə gələrlər və qələmin xoş rəftarlı atı onu hesablamaq meydanında ayaqlarını daşa vurar. Kamandarları ox zərbəsi ilə Nəsri-Tairi fələyin zirvəsindən yerə salarlar. Qılınc vuranları iti qılıncın qüdrəti ilə qantökən Mərrixin canından qiyamət gününün naləsini qopararlar. Nizə oynadanları nizənin ucu ilə qaranlıq gecədə dənizin dibindən balıq çıxararlar. [Onun ordusunun] igidləri döyüş gününü zifaf gecəsi bilərlər və nizə yarasını dadlı meyvə sayarlar.

Şeir

"Mələyə bənzər, div xasiyyətli, fələk təsirli, dağ görkəmli,
Timsaha oxşayan, aslan kimi bəla verən, pələng kimi coşan, fil yıxan.

---

[1705] Ürgənc (Urgənc) – orta əsrlərdə tarixi Xarəzm vilayətinin paytaxtı olan və hal-hazırda xarabalıqları Türkmənistanın Taşauz vilayətinin Künyə-Ürgənc qəsəbəsi ərazisində yerləşən şəhər. Bu Ürgənci Özbəkistanın eyni adlı müasir şəhəri ilə eyniləşdirmək düzgün deyildir.

[1706] Baroda nəşri: Xarəzm əvəzinə Xivə yazılmışdır.

[1707] Mənqit (manqıt) – əvvəlcə monqol-tatarların, sonra isə özbəklərin tərkibində yer almış bir tayfadır. Hal-hazırda Özbəkistanda və Qırğızıstanda Manqit adlı yaşayış məntəqələri mövcuddur.

[1708] *Qurani-Kərim, "Fəth" surəsi, 3-cü ayə.*

[1709] Bakı nüsxəsi: "Şahibəy xan".

Nizənin ucu ilə səmadan ulduzu qoparan igidlər,
Necə ki, sərçələr dimdikləri ilə yerdən darı toplayar”.

Şeybək xan daim ağzını açıb, “tezliklə İraq və Azərbaycan hüduduna qoşun çəkəcəyik və o məmləkətin işğalından sonra Hicaza hərəkət edəcəyik” – deyə boş-boş sözlər danışırdı. Buna baxmayaraq, həmin zaman o qədər qorxuya düşdü ki, qələbə şüarlı qoşunlar Səbzəvara gəlməzdən öncə, rəcəb ayının (04.10-02.11.1510) axırında, Ayın [astroloji cəhətdən] uğursuz mövqedə olduğu bir vaxtda Heratdan Mərvə qaçdı.

Şeir

“Aslan yıxan igidlərin nərəsindən,
Meşədən qaçdı o qızğın aslan.
Turan sərkərdəsi öz çapar atı ilə,
Şəhər qalasının ətəyinə qədər heç yerdə dayanmadı”.

O, balıq kimi haçaquyruq oxun qorxusundan, quruya çıxmış balıq kimi iztiraba düşdü, ilan rəftarlı oxun təlaşından, qabığını atan ilan kimi zirehini atdı və aslan kimi hiddətli ordunun qorxusundan, qarışqanın gözü boyda nicat yolu axtardı. Onun fərarından sonra Canvəfa mirzə Mavəraünnəhr camaatı ilə birgə xanın ardınca Mərvə doğru tələsdi. Şeybək xan qalaya sığınmağa qərar verib, şəhərdən kənardakı rəiyyəti şəhərə gətirərək Mərvin bürclərini və qala divarlarını elə möhkəmləndirdi ki, onu yazmaqla və deməklə şərh etmək mümkün deyildir. O, Übeyd xanı və Teymur sultanı çağırmaq üçün Səmərqəndə və Buxaraya elçilər göndərdi. Bu xəbərlər Tus ətrafında İsgəndər şanlı xaqana çatdı. [İsgəndər şanlı xaqan] səkkizinci imam Əli ibn Musa ər-Rzanın – ona, əcdadına və övladına Allahın salamı olsun – mələklərin yuvası olan astanasını təvaf etmək üçün öz nəfis vücuduna ehram bağlayıb niyaz və ixlas qədəmi ilə həmin Kəbə xüsusiyyətli məqbərəyə tələsdi.

Şeir

“Daxil oldu o can rahatlayan rövzəyə,
Qiyaməti görmədən behiştin içinə girdi.
Asiman rütbəli, ali məqamlı [şah],
Etdi təvaf belə bir Kəbəni tamam.
Oradan çıxdı həmin nöqsansız ay,
Astananı öpməklə dodağını bəzədi.
Fələk qaldı onun ayağının altında,
Çünki fəth pərvanəsi onun əlində idi”.

Böyük seyidləri, hörmətli nəqibləri və o sidrə məqamlı astananın mücavirlərini müxtəlif ehsanlar və ənamlarla xoşhal və şad etdi. O əsnada Cam ətrafına getmiş qələbə nişanlı qoşunun qaravulları din və dövlət düşmənlərinin əyanlarından bir neçə nəfəri əsir edib, səadət sığınacağı olan dərgaha gətirdilər. O yaramaz bədbəxtin (Şeybək xanın) və qara bəxtli camaatın (özbəklərin) əhvalını onlardan soruşdular. Onların dediyindən belə məlum oldu ki, Şeybək xan Mərv tərəfə fərar edib. Ona görə də qələbə ayətli bayraqlar Mərvə doğru hərəkətə gəldilər və Sərəxsdən Danə Məhəmməd bəy Əfşarı əzəmətli qazilərin bir dəstəsi ilə birlikdə mənqəlay kimi Mərv üzərinə göndərdilər.

Şeybək xan qələbə nişanlı əsgərlərin ön dəstəsinin yaxınlaşdığını öyrəndikdə özünün böyük əmirlərindən olan Canvəfa mirzəni və Qənbər bəyi bir dəstə bahadırla onları qarşılamağa göndərdi. Tahirabad kəndi ətrafında özbəklərlə qızılbaşlar bir-birinə çatdılar və silaha əl atdılar. İti qılıncın şimşəyindən hərb və savaş atəşi alovlandı və atəş saçan xəncərin ildırımından döyüşçülərin sinəsi kömür kimi yandı. Danə Məhəmməd özbəklərdən birinin [atdığı] oxla şəhidlik şərbətini içdi. Buna baxmayaraq, qazilər şahın dövlətinin qüvvəsi ilə üstünlük bayrağını ucaltdılar və özbək qoşununu Mərvin içinə qovdular.

Bu arada İsgəndər şanlı xaqan şaban [ayının] 20-də (22.11.1510) cah-calalla Mərvin ətrafına gəldi. Qızılbaş ordusunun igidlərindən Div sultan Rumlu, Çayan sultan Ustaclu, *Ziyadoğlu kimi məşhur olan Piri bəy Qacar*[1710], Badıncan sultan Rumlu, Zeynal xan Şamlu və Mirzə Məhəmməd Talış bir dəstə dilavərlə şücaət qılıncını sıyırıb darvaza üzərinə basqın etdilər və şeypur çaldılar. Bəhram kimi qəhredici özbək qoşu-

[1710] Bakı nüsxəsi (65a).

nundan bir dəstə şəhərdən çıxıb döyüş atəşini alovlandırmağa başladı. Hər iki tərəfdən bir çoxları qılınc və oxla öldürüldülər. Cahanı işıqlandıran günəşin qürubu səbəbindən zülmət niqabı insanın görmə qabiliyyətinin önündə əngəl olduğu üçün dəstələrdən hər biri öz mənzilinə (məkanına) çəkilib gecə vaxtı gözətçilik etdilər.

Şeir

"Elə ki sübh öz belindən kin qılıncını sıyırdı,
Həmin an gecə əjdahasını məğlub etdi".

Adlı-sanlı əmirlər atlara minib düşmənlərə sarı üz tutdular. O tərəfdən bir dəstə özbək onların qarşısına gəldi. Cövşən geyən dilavərlər yenidən Əxzər dənizi kimi coşub-gurlamağa başladılar, kəsici qılıncın və can alan nizənin zərbəsi ilə pəhləvanların can evində (bədənində) deşiklər açdılar.

Şeir

"Qalxandan başqa gəlmirdi o dəm xəyala heç nə,
Nizədən başqa keçmirdi o zaman ürəkdən heç nə.
Dəbilqə ilə baş, külahla kəllə arasında bir tük qədər fərq,
Qalmadı qətiyyən qılınc və balta yarası ucbatından.
Qılınc gah tənə vurdu, gah dil uzatdı,
Apardı dil yarası ilə dikbaşların başından beyinlərini".

Öldürmək və döyüşmək ifrat həddə çatsa da, gecənin qaranlığından göz nuru ətrafı görə bilmədiyi üçün o iki dəstənin hər biri öz mənzilinə gedib, gözətçilik etməyə başlayaraq asiman meydanından boylananlar (ulduzlar) kimi dan yeri sökülüncəyə qədər gözlərini bağlamadılar. Səhər çağı əmirlər qəzəbli aslanlar kimi qorxmaz igidlərdən [ibarət] bir dəstə ilə şəhəri ələ keçirmək üçün irəli atıldılar. Özbək qoşunundan da bir dəstə döyüşçü piyadalar, süvarilər və bahadırlar birlikdə darvazadan çıxdılar.

Nəzm

"Darvazadan çıxdılar hay-küylə,
Süvarilər və piyadalar axın etdilər.
Saysız-hesabsız bədbəxt və qaragün,
Səhra qumu və ağac yarpağı qədər".

Ox atmağa və qılınc çalmağa başladılar. Çaşt vaxtından ta "zülməti artan gecə"[1711] öz bayrağını qaldırana qədər "çox qızmar bir atəş"[1712] sancağının pərçimini sancdılar. Döyüş atəşi "Yer özünəməxsus bir şiddətlə lərzəyə gəlib titrəyəcəyi zaman"ı[1713] xatırladırdı. Yer piyadaların və süvarilərin qaçma-qovmasından "Rumlular məğlub oldular ən yaxın bir yerdə"[1714] [ayəsinin] təfsirini söyləyirdi. O hərb meydanında şücaət əlamətləri göstərən dilavərlərdən biri də Mirzə Məhəmməd Talış idi ki, bir dəstəni qəzəbli pələng kimi həlak torpağı üzərinə sərirdi və iki üzlü qılıncla düşmənlərin işini birdəfəlik həll edirdi. O, bəzi qazilərlə birlikdə yaralandı[1715]. Bu minvalla yeddi gün Mərv ətrafında qırğın odu alovlandı və qətl qığılcımları [qalanın] içində və bayırında olan adamların rüxsarının səhifələri üzərində parladı.

### Sultanlar savaşı və Məhəmməd xan Şeybaninin öldürülməsi haqqında söhbət[1716]

Səadətli xaqan bir neçə gün Mərvi mühasirə etdikdən sonra fəth və qələbə qapısı onun üzünə açılmadığı üçün könlündən keçdi ki, bir köç mənzili geri otursun, beləliklə, Şeybək xan cəsarətlənib Mərvdən çıxsın və o zaman geri qayıdıb onun işini bitirsin. O, bu düşüncəyə əməl edərək çaharşənbə günü, şaban [ayının] 28-də (30.11.1510)[1717] Mərv ətrafından hərəkət etdi və şəhərdən üç fərsəx aralı olan Mahmudi kəndi civarında dayandı. Bir gün və iki gecə o məkanda qaldı. Ertəsi gün Əmir bəy Türkmanı üç yüz süvari ilə Mahmudi çayı körpüsünün üzərində yerləşdirdi. Qərara alındı ki, Əmir xan özbək ordusunun qaraltısını görən kimi fə-

---

[1711] *Qurani-Kərim, "Züha" surəsi, 2-ci ayə.*
[1712] *Qurani-Kərim, "Qariə" surəsi, 11-ci ayə.*
[1713] *Qurani-Kərim, "Zilzal" surəsi, 1-ci ayə.*
[1714] *Qurani-Kərim, "Rum" surəsi, 2-cı və 3-cü ayələr.*
[1715] Baroda nəşri: "Ta ki, bəzi qazilər yaralandılar".
[1716] Məclis nüsxəsi: "İsgəndər şanlı xaqanın tədbir tökməsi və düşmənlər üzərində zəfər qazanması haqqında söhbət".
[1717] Göstərilən miladi tarix şənbə gününə təsadüf edir.

rar edib hökmdar məiyyətinə qoşulsun və beləliklə, düşmənlər cəsarətlənib o yolun üzərində olan bataqlıqdan keçsinlər.

Şeybək xan zəfər nişanlı qoşunların çıxıb getdiyini bildiyi (öyrəndiyi) zaman elə zənn etdi ki, o həzrət İraq və Azərbaycan hüdudunadək köhlən atının yüyənini dartmayacaqdır (dayanmayacaqdır). Birinci gün ehtiyat edərək Mərvdən çıxmadı və özünün dövlət xadimləri ilə məşvərət etdi. Böyük əmirlərdən olan Qənbər bəy və Canvəfa mirzə ərz etdilər:

- Yaxşısı budur, daha iki-üç gün gözləyək ki, Übeyd xan və Teymur sultan bizə qoşulsunlar. Ondan sonra [qaladan] çıxarıq. Çünki qızılbaşların köç etməsi zəiflikdən deyil, hiyləgərlikdəndir.

Bu sözü eşidən Şeybək xan lovğalıq və qürur hissinə qapıldığı üçün onlardan incidi və söyməyə başladı. Qənbər bəy və Canvəfa mirzə susdular. Şeybək xanın arvadı Moğol xanım dedi:

- Siz dəfələrlə İsgəndər şanlı xaqana təhdidlə dolu məktublar göndərib onu döyüşə çağırdınız. O, yorulub əldən düşmüş ordusu ilə uzaq yoldan Mərvə gəldi və siz namussuzluq torpağını başınıza töküb şəhərdən çıxmadınız. İndi artıq dövlətin faydası ondadır ki, könlünüzdə qorxu-hürküyə yol verməyib qüvvətli bir ürəklə müharibə meydanına gedəsiniz. Çünki qorxaqlıq və ürəksizlik kişilər üçün eyibdir.

Şeir

“Niyə qorxursan oxdan və qılıncdan,
Onda ötrü ki, iki-üç tikə daha artıq çörək yeyəsən?!
Əgər sənin üçün başın namusundan və ad-sanından daha üstündürsə,
Onda sənin başına sarıq deyil, kəlağayı yaraşar”.

Moğol xanımın sözündən Şeybək xanı qeyrət təri bürüdü. Cümə gününün səhər vaxtı o, ağacların yarpaqları və yağışların damcıları qədər çoxlu ordu ilə qala darvazasından çıxdı. Döyüşməyə gücünün və müqavimətə taqətinin olmamasına baxmayaraq, nakam bir şəkildə özünü timsahın ağzına atdı. Elə ki Mahmudi kəndinin yaxınlığına çatdı, Əmir bəy Türkman bir dəstə qazi ilə fərar vadisinə tələsdi. Şeybək xan ildırım və külək sürəti ilə bataqlıqdan keçdi. Amma qələbə şüarlı əsgərləri döyüşə və vuruşa hazır görüb heyrətləndi.

Nəql edirlər ki, Şeybək xanın nəzəri qızılbaş qoşununa sataşdıqda tələskənliyinə görə peşman oldu. Qəzəbli bir halda vəzir Xoca Mahmuda dedi:

- Canvəfa mirzənin yanına gedib onu müharibəyə həvəsləndir və mənim dilimdən söylə ki, ürəyini möhkəm saxla, mən qızılbaşları məğlub edəcəyəm.

Elə ki xoca xanın ismarışını ona çatdırdı, əvvəlcə etiraz edib söyüş söydü və xanın ünvanına nalayiq sözlər dilə gətirib dedi:

- Xana de ki, bu qoşun olduqca güclüdür və bizim malik olduğumuz adamlarla onları məğlub etməyimiz mümkün deyil. Təəssüf ki, bizim nəsihətlərimizi qəbul etmədi, bizi də, özünü də ölümə verdi və arvad-uşağımızı qızılbaşlara əsir etdi.

Lakin daha sonra o da səflərini tərtib etməyə başladı.

Şeir

“O tərəfdən qiyamət şövkətli xan,
Tərtib etdi Elburz dağı kimi bir səf.
Sağ və sol cinah tərtib olundu,
Növrəstə yırtıcı aslanlar dəstəsi ilə.
Hamısı aslan və bəbir kimi dəri geyib,
Dəmir içində gizləniblər başdan-başa bulud kimi.
Cavanları da, qocaları da sadə üzlüdür (üzü tüksüzdür),
Çünki timsahların üzündə tük olmur”.

[Şeybək xan] özü qoşunun mərkəzində dayandı, sağ və sol cinahları Qənbər bəyə və Canvəfa mirzəyə həvalə etdi. Zəfər bayraqlı xaqan (Şah İsmayıl) isə Əmir bəyin əsas məiyyətə yetişməsi ilə düşmənlərin yaxınlaşdığından agah olub, zəfərin varid olduğu qoşunları tərtib etməyə başladı. O, sağ və sol cinahlara

Əmir Nəcmi-Sani, Bayram bəy Qaramanlu, Çayan sultan Ustaclu, *Piri bəy Qacar*[1718], Div sultan Rumlu, Hüseyn bəy Lələ, Abdal bəy Dədə, Zeynal xan Şamlu və Badıncan sultan Rumlu kimi adlı-sanlı əmirləri yerləşdirdi. Ondan sonra ərəb atlarının kişnəməsindən, Hicaz dəvələrinin hikkəsindən, nağara və şeypur sədasından göy qübbəsinə hay-küy düşdü.

Şeir

"Minik heyvanlarının tapdaqlarından zəlzələ bürüdü yeri,
Və kosun nəriltisindən asimanın qulağı kar oldu.
Yerdən və göydən qiyamət tozu qopdu,
Məhşər gününün fitnə-fəsadı aşkar oldu məgər".

Ondan sonra div xasiyyətli bahadırlar və döyüşkən qazilər kin qılıncını sıyırıb bir-birinə hücum çəkdilər. Qılıncın işığı parlayan şimşək kimi zülm atəşini alovlandırdı və ildırım kimi parlaq nizələr həyat xırmanını yandırdı. İsgəndər şanlı xaqan sarığını tacından açıb, zülfüqar[1719] əndamlı qılıncını intiqam qınından sıyıraraq düşmənlərə həmlə etdi.

Şeir

"Onun oxu haraya qanad açdısa, ardından zəfər gəldi,
Onun qılıncı haraya toxundusa, işin öhdəsindən gəldi.
Şahın nizəsinin və qılıncının qorxusundan,
Əjdaha başını daşın altında gizlədirdi.
Fəth və zəfər baharında laləzar oldu çöl,
Toz bulud oldu, kos ildırım, qılınc şimşək, qan yağış.
Rəqib qılınc vururdu qorxu dolu ürəklə,
Şahənşaha qarşı kinlə bağlamış on yerdə kəmər".

İsgəndər şanlı xaqan büllur rəngli qılıncı ad-san sahiblərinin qanı ilə qırmızıya boyadı və qan saçan oxun ucu ilə düşmənlərin ürəyini və gözünü Bədəxşanləlinə bənzətdi. Qazilərin nizələri bahadırların şah damarlarından qan bronxları açdı və özbəklərin ürəyi nişan alan oxları igidlərin sinəsinin hədəfinə dəyib onların varlıq nağdını yoxluq küləyinə verdi. Şeybək xan "And olsun Günəşə və onun işığına (günəşin qalxdığı vaxta)"[1720] [ayəsində deyildiyi kimi] günəşin doğuşu vaxtından "And olsun sakitləşməkdə olan (və ya getdikcə zülməti artan) gecəyə"[1721] [ayəsində işarə edilən] zamana kimi (səhərdən axşama qədər) səbat və qərar ayağını [yerə] dirədi və inadkarlıq bayrağını qaldırdı. Axırda Bəhram kimi hiddətli ordu dövlətin gücü və səadətin qolunun zoru ilə özbək qoşununu məğlub etdi və günəş kimi qılınc vurub əndazəsiz düşmənləri zərrə kimi tar-mar etdilər.

Şeir

"O çöl donuzlarının səfi pozuldu,
Onlar ahu kimi aslanlara giriftar oldular[1722].
Əsir aparanlar bütünlüklə əsir oldu,
Onların kamandarları ox zərbəsi ilə öldürüldü".

Xorasan camaatından Xoca Cəlaləddin Mahmud, Xoca Hüseyn Divan və Xoca Abdulla Mərvi bir sıra özbəklərlə birlikdə öldürüldülər. Qənbər bəy və Canvəfa mirzə əsir alındılar və zaman qəhrəmanının (Şah İsmayılın) hökmü ilə qətlə yetirildilər. Qılıncdan qurtulan yaramaz özbəklər fərar edən zaman çarəsizlik üzündən özlərini bataqlığa yetirdilər və onu keçməyi xilas səbəbi bildilər. Lakin onlar həlak girdabına düşdüklərindən xəbərsiz idilər. Nəhayət, Mahmudi çayı çoxlu adamlar və atlarla doldu. Çayı keçən hər kəs adamların və atların üzərindən keçib gedirdi. Şeybək xan o qiyamətdən qaçarkən özünü dörd divarin içinə saldı. Onun oradan qurtuluş yolu yox idi. Bir dəstə qazi həmin çəpərlənmiş yeri mühasirəyə aldı. Özbəklər izdihamın son dərəcə çox olması ucbatından bir-birinin üstünə çıxmışdlar. Onların çoxu minik heyvanlarının

[1718] Bakı nüsxəsi (67b).
[1719] Zülfüqar – Həzrət Əlinin iki uclu qılıncıdır.
[1720] *Qurani-Kərim, "Şəms" surəsi, 1-ci ayə.*
[1721] *Qurani-Kərim, "Züha" surəsi, 2-ci ayə.*
[1722] Nuruosmaniyyə və Məclis nüsxələri: "Sanki Elburz dağı viran oldu".

əlləri-ayaqları altında qalıb həlak oldu. Həyatlarının son nəfəslərini çəkənlər isə ölülərin üzərinə ayaqlarını qoyaraq o divarın üstünə çıxdılar və qazilərin qılıncı ilə ölüm şərbətini içdilər. O qövmdən dörd divar arasında olanların hamısı öldürüldükdən sonra şah məiyyətinin bəzi mülazimləri[1723] ölülər arasında Şeybək xanı tapdılar. O, adamların izdihamı üzündən boğulub canını təslim etmişdi. İsgəndər şanlı xaqan həmin an buyurdu ki, onun şərlə dolu başını bədənindən ayırıb dərisini soysunlar və içinə saman təpib Rum padşahı Sultan Bayəzidə göndərsinlər. Kəllə sümüyünü (qafa tasını) isə qızıla tutub ondan bir qədəh düzəltsinlər və onun içinə şərab töküb behişt ayinli məclisdə gəzdirsinlər. Bu mətlə onun halına münasibddir:

Şeir

“Dövran gərdişindən qafam çevrilibdir piyaləyə,
Bu xaraba zaman məni döndərdi lap avarəyə”.

Mamuş, Qazı Mənsur və özbək tayfasının bütün əmirləri, rəisləri və əyanları və o alçağın əsgərlərindən təxminən on min nəfər döyüş meydanında qətlə yetirildilər. O diyarda onlardan nişan qalmadı və “Zülm edənlər hansı dönüşə dönəcəklərini mütləq biləcəklər”[1724] məfhumu aşkar oldu. Xorasan məmləkətinin gülzarı o murdar tayfanın tikanından və zir-zibilindən təmizləndi.

Bu hal əsnasında kama çatmış İsgəndər şanlı xaqan gediş bayrağını Mərvə doğru yüksəltdi, son dərəcə mərhəmətlə Mərv əhlinin üzərinə rəğbət kölgəsini saldı, Şeybək xanın illərlə yığıdığı malları əmirlərə və qazilərə payladı, Mərv hakimliyini Dədə bəyə lütf etdi, məmləkətlərə fəthnamələr göndərdi və hərəkət bayrağını darüssəltənə Herata doğru qaldırıb orada qışlamağı qərara aldı.

Übeyd xan, Şeybək xanın köməyinə gələn zaman təsadüf elə gətirdi ki, o, özbək qoşununun darmadağın olduğu vaxt oraya yetişə bildi və Moğol xanımı götürüb məyus və pərişan halda Buxaraya yönəldi.

**Müxtəlif hadisələr**

Bu il Şeyban ibn Cuci xan ibn Çingiz xan övladlarından (nəslindən) İlbars xan Xarəzmi ələ keçirdi və Köpək bəy Quşçunu o diyara daruğalıq etməyə göndərdi. Bu ildə ki İsgəndər şanlı xaqan Xorasanı zəbt etdi, Xorasanın əmirliyini Atlandı bəyə tapşırdı. O əsnada Xızır elinin əmiri Şərif Sufi (Şərif Sufi əmiri-Xızır eli) Xarəzmi ondan (Köpək bəy Quşçudan) aldı. İlbars müqayisəyəgəlməz qoşunla Dəşti-Qıpçaqdan o diyara gəldi. Şərif Sufi Xarəzm hakimliyini ona təhvil verdi.

Bu ilin qışlaq çağında Xan Mirzə adı ilə məşhur olan Mirzə Sultan Üveys ibn Mirzə Sultan Mahmud ibn Sultan Əbu-Səid Bədəxşandan bol peşkəşlə İsgəndər şanlı xaqanın dərgahına gəldi və bir neçə gündən sonra öz ölkəsinə döndü.

Həmçinin bu il Sultan Səlim öz atası Sultan Bayəzidlə Ədirnə və İstanbul arasında yerləşən Keli mövqeyində[1725] böyük bir döyüş etdi. Sultan Səlim Trabzon tərəfə qaçdı.

**Ölümlər**

Şeybək xan ibn Budaq sultan ibn Əbülxeyr xan ibn Dövlətşeyx-oğlan ibn İlti-oğlan ibn Fulad-oğlan ibn Aybə Xoca[1726] ibn Toqtay ibn Bulğan ibn Şeyban ibn Cuci ibn Çingiz xan[1727]. Onun anası Quzu bəyimdir[1728]. Uşaqlıq dövründə atası ölmüş, onu babası Əbülxeyr xan saxlamışdır. Babasının ölümündən sonra Dəşti-Qıpçaq hakimi Qasımxan sultanın yanına getmiş və tam qayğı görmüşdür. Bir neçə gündən sonra özbək tayfasını özünə müttəfiq edib Otrar və Səbrana[1729] yönəldi. [Lakin] oranın hakimi Canibəy xan oğlu İrənci xan qarşısında məğlubiyyətə uğrayıb Buxaraya tələsdi. Sultan Əbu-Səid oğlu Sultan Əhməd mirzə tərəfin-

[1723] Bakı nüsxəsi: “Əziz ağa Bozcalu” (68b).

[1724] *Qurani-Kərim, “Şüəra” surəsi, 227-ci ayə.*

[1725] Bakı nüsxəsi: “dağlıq bir yerdə”. Səlimlə atası arasında döyüş Uğraşköy adlı yerin yaxınlığında baş vermişdi *(Nəvai, şərhlər, s.1055).*

[1726] Bakı nüsxəsi: “Əbih Xoca”.

[1727] Şeybani xanın şəcərəsi bəzi digər qaynaqlarda bu cür təqdim edilir: Məhəmməd Şeybani xan ibn Şah Budaq sultan ibn Əbülxeyr xan ibn Dövlətşeyx sultan ibn İbrahim sultan ibn Pulad sultan ibn Mengü Teymur xan ibn Badaqul ibn Cucibuğa ibn Esubuğa ibn Banyal Bahadır ibn Şeyban Bahadır xan ibn Cuci xan ibn Çingiz xan *(Фазлаллах ибн Рузбихан Исфахани. Михман-наме-йи Бухара. Пер. Р.П.Джалиловой. Москва, 1976, с.61-62).*

[1728] Bakı nüsxəsi: “Tuzi bəyim”.

[1729] Baroda nəşri: “Seyran”.

dən Buxara hakimi olan Əbdüləli xan Tərxan ona ehtiram göstərib Səmərqəndə, Sultan Əhməd mirzənin yanına apardı. İki il o diyarda qaldı. Ondan sonra Dəştə yollanıb, Dəşt padşahı Bərəndüq xanla döyüşərək qalib gəldi və Səbranı ələ keçirdi. Necə ki, qeyd edilmişdir. Görkəm baxımından Gödəcə Əhməd ibn Uğurlu Məhəmməd ibn Həsən padşaha tam oxşarlığı vardı. Ömrünün müddəti altmış bir il, səltənət əyyamı on bir il olmuşdur. Məmləkəti Mavəraünnəhr, Xorasan, Hisari-Şadman və Bədəxşan idi. Onun qətlindən sonra oğlu Teymur sultan Səmərqənddə öz adına sikkə kəsdirdi və Übeyd xan Buxarada səltənət bayrağını qaldırıb Şeybək xanın arvadı ilə evləndi. Canibəy sultan isə Kərminiyyə vilayətini ələ keçirdi.

Xorasanın fəthindən öncə Mazandaran hakimi Ağa Rüstəm Ruzəfzun bir gün demişdi ki, əl mənimdir, ətək Şeybək xanın (mənim əlim Şeybək xanın ətəyindədir). İsgəndər şanlı xaqan, Şeybək xanı qətl etdikdən sonra hökm verdi ki, Dərviş Məhəmməd Yasavul, Şeybək xanın bir əlini Sariyə aparıb Ağa Rüstəmin ətəyinə atsın. Ona görə də [Ağa Rüstəm qorxudan] xəstəliyə düçar olub vəfat etdi. Ondan sonra oğlu Ağa Məhəmməd, Əmir Əbdülkərimlə və Xoca Müzəffər Bitikçi ilə birlikdə İsgəndər şanlı xaqanın ordusuna yollandı. Simnan ətrafında onlar zəfər nişanlı şahın dərgahına yetişdilər və üç min tümən məbləğində tərcüman[1730] vergisi ödəməyi qəbul etdilər.

Heratlı şeyxülislam (Şeyxülislami-Herati)[1731] təfsir, hədis və fiqh elmində əsrin yeganəsi idi və Sultan Hüseyn mirzə zamanında təqribən otuz il Xorasanda şeyxülislam olmuşdu. O, sünni olduğu üçün ramazan ayında (1510-cu ilin dekabrında) İsgəndər şanlı xaqanın fərmanı ilə öldürüldü[1732].

## 917-CI İLDƏ (31.03.1511 – 18.03.1512) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il İsgəndər şanlı xaqan Heratdan Mavəraünnəhr vilayətinə yönəldi. Meymənə və Faryaba çatdığı zaman Übeyd xanın və Teymur sultanın elçiləri çoxlu peşkəş və saysız töhfələrlə fələk vüqarlı orduya gələrək hədiyyələri əşrəfin nəzərləri qarşısına qoydular. Həmçinin itaət və tabeçilikdən ibarət olan bir ərizə təqdim etdilər. Orada yazılmışdı ki, "Mavəraünnəhr məmaliki-məhrusə hökmündədir; nə ehtiyac var ki, kama çatmış hökmdar (Şah İsmayıl) oranı fəth etmək üçün təşrif gətirsin?!". Ona görə də İsgəndər şanlı xaqan onların xahişini qəbul edib, Bəlx, Şibirğan və Əndixud hakimliyini Bayram bəy Qaramanluya həvalə etdi və qayıdış yüyənini İraqa tərəf döndərərək Qum şəhərində qışlaq etdi. Baharda cərgə ovu təşkil etmək fikrinə düşüb Savə mahalının Rasfəcan kəndində ova çıxdı. Təqribən iyirmi dörd min vəhşi heyvan ovlandı və oradan Beşbarmaq yaylağına[1733] gedib o məkandan Surluq yaylağına yönəldi.

### Rum vilayətində baş vermiş hadisələr haqqında söhbət

Bu il Təkkə-eli deyə tanınan Məntəşa və Gərmiyan vilayətindən Şahqulu Baba Təkəlü bir dəstə sufi ilə birlikdə Cəmşid məqamlı xaqanın dərgahına getmək üçün ehram bağlayıb Azərbaycana yollandı. Təkkəeli vilayətinin hakimi, Sultan Bayəzidin mülazimi olduğundan, yaxşı silahlanmış dörd min süvari ilə ali səviyyəli sufiləri dəf etməyə gəldi və Şahqulu Baba yüksək qeyrətli qazilərlə rumilərin qarşısına çıxdı. İki qoşun arasında döyüş atəşi alovlandı. Hidayət sahibləri zəlalət sahiblərinə qalib gəlib onların sərdarını qətlə yetirdilər. Rumilərdən bir çoxları əsir və dustaq edildilər. Şahqulu Baba əsirlərin hamısını qılıncdan keçirdi. Babanın qələbəsinin xəbəri xanədan müridlərinə yetişdikdə, sözügedən vilayətin ətrafında və yan-yörəsində silahı və hazırlıqlı şəkildə Babaya qoşulub, Qaraman vilayətini zəbt etmək fikrinə düşərək o hüduda gəldilər.

Qaragöz paşa o zaman Sultan Bayəzid tərəfindən oranın hakimi idi. O, həmin ordudan xəbər tutduqdan sonra qoşununu tərtib etməyə başlayıb hərb etməyə qərar verdi. İki qoşunun bir-birinə yaxınlaşmasından sonra döyüş atəşi alovlandı. Hər iki tərəfdən bir dəstə adam həlak torpağı üzərinə düşdü. Fəth mehi Babanın bayrağının pərçiminə əsdi. Qaragöz paşa fərar etməyə qərar verdi. Sufilər təqib etdilər və onların mallarını ələ keçirib Sivasa yönəldilər.

---

[1730] Tərcüman rüsumu – dövlət qarşısında müəyyən təqsirləri olmuş şəxsdən alınan cərimə vergisi.

[1731] Seyfəddin Əhməd ibn Qütbəddin Yəhya ibn Məhəmməd ibn Məsud əl-Təftazani nəzərdə tutulur *(Nəvai, şərhlər, s.1056).*

[1732] Onun edamını sadəcə dini mənsubiyyətlə əlaqələndirmək doğru deyildir. Bu qətlin ilk növbədə siyasi səbəbləri vardı. I Şah İsmayıl dövründə Mazandaran hakimlərindən Əmir Hüseyn Kiya Çəlavi kimi bəzi siyasi liderlər şiə olmalarına rəğmən məhz Səfəvilərə tabe olmaqdan boyun qaçırdıqları üçün ortadan qaldırıldıqları halda, sünni olan Şəki hakimi Həsən bəy və Şirvanşah II İbrahim Səfəvilərə itaət etdikləri üçün öz hakimiyyətlərini davam etdirmişdilər.

[1733] Beşbarmaq yaylağı – Savə və Sultaniyyə şəhərləri arasında yerləşir *(Seddon, şərhlər, s.242).*

Bu məğlubiyyət xəbəri Sultan Bayəzidə çatdıqda böyük vəzir (vəziri-əzəm) olan Xadim Əli paşanı əlli min süvari ilə Babaya qarşı vuruşmağa göndərdi. Adı çəkilən paşa qaranlıq gecədə nizənin ucu ilə ayın üzündən ləkəni aparan bir ordu tayfası ilə sufilərin üzərinə hərəkət etdi. Düşmənlərin gəlişindən agah olan Şahqulu Baba qoşununu tərtib etməklə məşğul oldu və yanında olan min həbəş qulamını qoşunun önündə yerləşdirdi. O tərəfdən Əli paşa öz qoşununun sol və sağ cinahlarını tərtib edib savaş meydanına gəldi. Rum qoşununun hamısı birdən qazilərin qoşununun önündə olan piyadalara həmlə edib təxminən beş yüz nəfəri qətlə yetirdilər. Qılıncdan qurtulanlar mərkəzə çəkildilər. Baba iki cinahı mərkəzdə birləşdirib, fədaicəsinə Əli paşaya həmlə etdi.

Şeir

“Hücum etdilər o dəmir papaqlı igidlər,
Hamısı birdən ordunun mərkəzinə”.

İlahi imdad mehi əsməyə və düşmənlərin ürəkləri titrəməyə başladı. Əli paşa məğlub olub geri çəkildi.

Şeir

“Rum süvariləri o qiyamətdən,
Üz tutdular qaçış yoluna”.

Təkəlülər onları təqib edib kəsici qılınc və can alan nizə zərbəsi ilə Əli paşanı bir sıra rumilərlə birlikdə qətlə yetirdilər. Baba da şəhidlik şərbətini içdi. Sufilər Xəlifə Babanı (və ya Babanın xəlifəsini) özlərinə başçı seçib Ərzincana yollandılar. O şəhərin ətrafında eşitdilər ki, beş yüz nəfər tacir bol əmtəələr və çoxlu mallarla Təbrizdən çıxıb Ruma gedirlər. Onların tamah qüvvəsi hərəkətə gəldi və gözlənilməz bəla kimi o biçarələrin üstünə gedib hamısını öldürdülər.

Şeir

“Kimsə öz canını onların əlindən sağlam qurtarmadı,
Əcəldən başqa canını qurtaran olmadı”.

Onların mallarını talan edib ulu dərgaha yollandılar. O zaman İsgəndər şanlı xaqan Xorasan vilayətindən qayıdıb Reyin Şəhriyar adlı yerində məskən salmışdı. Orada təkəlü sufiləri hökmdar məiyyətinə qoşuldular və [şahın qarşısında] torpağı öpmək izzətinə nail oldular. O həzrət onların başçılarını tacirlərin qətlinə görə cəzalandırdı və digər döyüşçüləri əmirlər arasında paylaşdırıb xidmətə götürdü (mülazim etdi).

**Babur padşahın Həmzə sultan və Mehdi sultan Özbəklə müharibə etməsi haqqında söhbət**

Bu il Babur padşah Hisari-Şadmana, Bədəxşana, Qunduza və Bəğlana yönəldi. O vilayətin hakimi olan Həmzə sultan və Mehdi sultan o yüksək məqamlı padşahın gəlişindən xəbər tutub, Toxarıstanın qoşunlarını toplayaraq onu qarşılamağa tələsdilər. İki ölkənin sərhədində bir-birinə yetişdilər. Elə vuruşdular ki, dəmir qəlbli qılınc döyüşçülər üçün qan ağladı. Babur padşah kinli aslan kimi bədxah orduya hücum etdi. Düşmənlər tab gətirməyib fərar etdilər. Həmzə sultan və Mehdi sultan öldürüldülər. Babur padşah son dərəcə əzəmətlə Bədəxşanda yerləşdi və İsgəndər şanlı xaqanın yanına şirin dilli elçilər göndərib ərz etdi ki, əgər o həzrət bir dəfə qazilərdən bir dəstəsini köməyə göndərsə, Səmərqənd və Buxara vilayətinin onun bu dostunun (Baburun) əlinə keçməsi, orada sikkənin və xütbənin bəndələr şahının (Şah İsmayılın) ləqəbləri ilə zinətlənməsi mümkündür.

Ona görə də İsgəndər şanlı xaqan Əhməd bəy Sufioğlunu və Şahrux bəy Əfşarı izdihamlı qazilərin bir dəstəsi ilə Babur şaha kömək etməyə göndərdi. Babur padşah dərgah əmirləri ilə birlikdə kinli özbəkləri dəf etməyə yollandı. Teymur sultan və Übeyd xan mülkün varisinin gəlişindən xəbər tutub Türküstan tərəfə tələsdilər. Babur padşah dövlətsevər qazilərlə birlikdə Səmərqəndə daxil oldu. İsgəndər şanlı xaqanın adına xütbə oxudular və sikkələrdə on iki imamın – onlara Allahın salamı olsun – adları nəqş edildi. Xaqanın (Şah İsmayılın) hökmü ilə [Babur], Xan Mirzəni Bədəxşana hakim yolladı və Əhməd bəy Sufioğlunu bol peşkəşlə dünya qədər hörmətli xaqanın dərgahına göndərdi. Amma bir iş üçün Səmərqəndə getmiş Nəcm bəyin eşik-

ağası[1734] olan Məhəmmədcan ağaya lazımınca ehtiram göstərmədi. Məhəmmədcan ağa Qumda hökmdar ordusuna yetişən zaman ərz etdi ki, Babur padşah itaətsizlik xəyalına malikdir. Bu xəbəri eşidən Fəridun şöhrətli padşah (Şah İsmayıl) Baburu dəf etmək fikrinə düşdü. Vəkil Nəcmi-Sani özünün Mavəraünnəhrə göndərilməsini təklif etdi. İsgəndər şanlı xaqan onun xahişini qəbul edib hökm verdi ki, adlı-sanlı əmirlərdən Zeynalabidin bəy Səfəvi, Piri bəy Qacar və Badıncan bəy Rumlu, Nəcmi-Sani ilə birlikdə Mavəraünnəhrə yollansınlar. Əmir Nəcm tam şövkətlə, idrak və təsəvvürün çərçivəsini aşacaq dərəcədə bir lovğalıq və qürurla məqsədə doğru yola çıxdı.

### Müxtəlif əhvalatlar

Bu il Əmir Seyid Şərif Şirazi İraqi-Ərəbə[1735] yollandı və İsgəndər şanlı xaqan zilhiccə [ayının] (19.02-18.03.1512) əvvəllərində sədarət mənsəbini Rəbbani arif olan Əmir Nemətulla Kirmaninin övladlarından (nəslindən) Əmir Əbdülbaqi Yəzdiyə həvalə etdi.

### Ölümlər

Bu il Mövlana Fəsihəddin Sahibi-Dara qürur məkanından sürur məkanına (dünyadan axirətə) köçdü. O, şətrənc fənnində (şahmat oyununda), istər böyük olsun, istər kiçik olsun, hər kəsdən daha çox məharətli idi. Mövlananın nadir şeirləri cümləsindən biri Əmir Əlişir mərsiyəsinə dair qəsidəsidir.

Şahqulu Baba Təkəlü, Həsən xəlifənin oğludur. Həsən xəlifə iki dəfə Sultan Heydərin[1736] xidmətinə gəldi. O həzrət onu qırx nəfər sufi ilə çilləxanaya göndərdi və onların hər birinə bir kuzə su və bir çörək verdi ki, qırx gün ərzində bu qədər yeməklə qənaət etsinlər. Bu müddət bitdikdən sonra çilləxanadan çıxanda [məlum oldu ki], bütün sufilər öz qida paylarını istifadə etmişlər. Yalnız Həsən xəlifə ona veriləni eynən zəmanənin qütbünə (Sultan Heydərə) qaytardı. Mürşidi-kamil ona rüxsət verib Təkkə-eli vilayətinə yolladı. Elə ki o diyara çatdı, öz mənzilində qərar tutdu. Sultan Heydərin sufilərindən biri olan Pirə Sinan məclisdə hazır olanlara dedi:

- Həsən xəlifə gəldi, lakin [özü ilə birlikdə] Təkkə-eli vilayətinə yanar bir atəş də gətirdi.

O zaman Allah-taala Şahqulu Babanı Həsən xəlifəyə bəxş etdi. Qış vaxtı təkə-yaxırlu[1737] camaatı arasında olurdu və yayı təkərmişlü icmasının arasında keçirirdi. Ondan kəramətlər baş verirdi və adamlar ona tabe olurdular. Qeyd edildiyi kimi, o, Rumda qiyam qaldırdı.

## 918-Cİ İLDƏ (19.03.1512 – 08.03.1513) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Babur padşahın Übeyd xan və Canibəy sultan Özbəklə müharibə etməsi

Bu il Übeyd xan, Teymur sultan və Canibəy sultan izdihamlı bir ordu və saysız[1738] məiyyətlə Buxaraya doğru hərəkət bayrağını qaldırdılar. Onların mənqəlayı o şəhərin ətraf nahiyələrini çapıb-taladı. Bu xəbər Babur padşahın qulağına çatdıqda az qoşunla özbəkləri dəf etməyə yönəldi. Məhəmməd Məzid Tərxan, padşaha ərz etdi ki, hazırlıqsız şəkildə düşmənin üzərinə getmək dövlətə layiq deyil. [Lakin o, bunu] qəbul etməyib yola düşdü və Buxara yaxınlığında eşitdi ki, özbəklər bir neçə köç mənzili geri çəkiliblər. [Buna görə də Babur] cəsarətlənərək onları təqib etdi və iki-üç köç mənzili o şövkətsiz güruhun ardınca getdi. Übeyd xan, Teymur sultan və Canibəy sultan zəfər şüarlı ordularının sağ və sol cinahlarını bacarıqlı adamlarla və döyüş günü bahadırları ilə möhkəmləndirib, ürəklərini qorxu və xofdan azad edərək o səhrada ortaya çıxdılar. Məhəmməd Babur da bu cəsarəti və rəşadəti müşahidə etdikdən sonra qoşununu tərtib etməklə məşğul oldu. Hər iki tərəfin igidləri və bahadırları mübarizə meydanına ayaq qoyub ox atmaq və qılınc oynatmaq üçün əl uzatdılar.

---

[1734] Eşikağası – saray təşrifat məmuru. Eşikağasıbaşı – sarayın baş təşrifat müdiri. Onun tabeçiliyində çoxsaylı saray xidmətçiləri (yasavullar, eşikağasılar, xacəsaraylar, qapıçılar, carçılar və s.) vardı.

[1735] Məclis nüsxəsi: "İraqi-Əcəmə".

[1736] Şeyx Heydər Səfəvi nəzərdə tutulur.

[1737] Baroda nəşri: "təkə-yaxa"; Məclis nüsxəsi: "təkə-yaxalu".

[1738] Baroda nəşri və Bakı nüsxəsi: "çoxsaylı".

Şeir

“Qılınc dişini itiləyib tunc bədənlilərin bədəni üzərində,
Əlini pəhləvanların qanına bulayıb hər dəm balta.
Dikbaşlara qarşı əyib öz şəstini kaman,
Uçan oxlara qarşı sinəsini qabardıb qalxan.
Nizə cövşəndən keçib, daş kimi sinəni yaralayıb,
Necə ki, əjdaha tikanı gül yarpağını dişləyib”.

Sözün qısası, elə bir döyüş etdilər ki, bu mavi hasarın damında (asimanın zirvəsində) xəncər vuran Bəhramın ürəyi o vurhavurun heybətindən titrədi və sitəmkar fələk intiqam məqamından əl çəkib meydan mübarizləri üçün can sağlığı istədi. Cağatay igidləri qalib gəldilər. Urus bəyi, Köpək bəyi və Xoca Əhməd Qünqüratı bir sıra özbəklərlə birlikdə ələ keçirib Babur padşahın yanına gətirdilər və onun hökmü ilə onlar qətlə yetirildilər. Özbək qoşunu qaçmağa üz qoydu. Cağataylar onları təqib etdilər. Qaçaqaç əsnasında Übeyd xan yaxşı silahlanmış iki yüz nəfərlə bir çuxurda gizlənib fürsət gözləyirdi.

Babur padşah döyüş meydanında kinli özbəklərdən əsər-əlamət görmədiyindən, mərkəzdə olan qoşunu onların ardınca göndərdi və onun həndəvərində beş yüz nəfərdən artıq adam qalmadı. Übeyd xan cahana işıq saçan ildırım kimi iki yüz nəfər igidlə gizləndiyi yerdən çıxıb cağatay qoşununa həmlə etdi. Babur padşah da müdafiə olunmağa başladı. Cəsur bahadırlar can alan oxların ucu ilə döyüşçü aslanların bədənlərini deşik-deşik etdilər. Həmin gün savaş meşəsinin aslanı olan adlı-sanlı Bayaqu Bahadır iyirmi süvarini gürz zərbəsi ilə yerə sərdi. Babur padşah fəth və zəfərin hüsn-camalını görəcəyinə ümidvar olmuş ikən məğlubiyyətlə üzləşib, könlünü mülkdən və maldan çəkərək Buxara tərəfə qaçdı. Übeyd xan öz çoxbilmişliyindən səadət hilalını gördükdən sonra Babur padşahın yerində dayanıb, öz bayrağını endirərək Baburun bayrağını qaldırdı. Ondan ötrü ki, özbəkləri təqib edən kəslər geri qayıtdıqda zənn etsinlər ki, [orada dayanan] Babur padşahdır və yaxına gəldikləri zaman özbəklər onları qətlə yetirsinlər. Bu hiylə ilə beş yüz nəfər, bəlkə, daha artıq cağatay öldürüldü. Babur padşah Buxaradan Səmərqəndə yönəlib, öz ailəsini və köçünü götürərək Hisari-Şadmana yollandı. Übeyd xan və Canibəy sultan hər biri öz məskəninə getdi və sözügedən ilin cəmadiyüləvvəl ayında (15.07-13.08.1512) bir-birinə qoşulub Hisari-Şadmana yönəldilər. Babur padşah, Xan-Mirzə ilə ittifaqda iç qalanı möhkəmləndirib, öz mülazimini Bəlxə göndərərək yardım və kömək xahiş etdi. Bayram bəy Qaramanlu, Əmir Məhəmməd Şirazini fədakarlıq yolunu tutmuş qazilərdən [ibarət] bir dəstə ilə Babur padşaha kömək etməyə göndərdi. Özbək sultanları qazilərin gəlişindən xəbər tutub bu təşəbbüslərinə görə peşman oldular və geri qayıtdılar.

## Übeyd xanın Nəcm bəylə[1739] müharibə etməsi haqqında söhbət

Bu xəbər Nəcm bəyə çatdıqda, özbəkləri dəf etməyi qarşıya məqsəd qoyub on-on iki min atlı ilə Xorasan hüduduna gəldi. Herat hakimi Hüseyn bəy Lələ mücadilə meydanının aslanlarından [ibarət] bir dəstə ilə ona qoşuldu və bu iki xoşbəxt birlikdə Mavəraünnəhrə yönəldilər. Bəlx hüdudunda Bayram bəy Qaramanlu onlara ziyafət verdi və qonaqpərvərlik göstərdi. Əmir Nəcm təxminən iyirmi gün Bəlxin xaricində qərar tutub bir dəstə qazini çay kənarına göndərdi ki, çoxlu gəmi toplasınlar. Ondan sonra yağış damlalarından çox olan qoşunla Ceyhundan keçərək Əmir Məhəmməd Yusifi Babur padşahın yanına göndərdi və sifariş etdi: “O həzrət (Babur) tezliklə bu tərəfə gəlsin ki, ölkənin fəthi işlərinin icrasında onun doğru yol göstərən fikrinə əməl edək”. Əmir Məhəmməd Yusif Hisari-Şadmana getdi. Babur padşah ona ziyafət verdi. Daha sonra o, öz qoşununu da götürüb Əmir Məhəmmədlə birlikdə qələbə nişanlı ordugaha yollandı. Padşahın yaxınlaşdığını öyrənən Əmir Nəcm böyük əmirlərlə birlikdə onu qarşılamağa çıxdı və Dərbəndi-ahənin[1740] mövqeyində iki səadət ulduzunun görüşü baş verdi.

---

[1739] Məclis nüsxəsi: “Nəcmi-Sani ilə”.

[1740] Dərbəndi-ahənin (“dəmirdən bağlı qapı”) – Baysuntau dağlarında məşhur bir keçiddir. Buxara və Səmərqənddən Bəlxə gedən əsas yol buradan keçirdi *(Мирза Мухаммад Хайдар. Тарих-и Рашиди /перевод с персидского А.Урунбаева, Р.Джалиловой и Л.Епифановой/. Ташкент, 1996, гл. 6, прим. 49).*

O biri tərəfdən özbək sultanları Nəcm bəyin qoşunlarının çayı keçməsindən xəbər tutub taxılları qalaya[1741] daşıdılar, bürc və divarları möhkəmlətdilər. Əmir Nəcmi-Sani əzəmət və bəxtəvərliklə qalaya doğru hərəkətə keçdi. Oranın hakimi olan Fulad sultan sülhə meyil göstərib əhd-peyman bağlandıqdan sonra əyan və kələntərərlə birlikdə qaladan çıxdı. [Lakin] Əmir Nəcmin fərmanı ilə onu həmin qalada sakin olan bir dəstə özbəklə birlikdə cəzalandırdılar (öldürdülər). [Nəcm bəy] oradan hərəkət bayrağını Qərşi[1742] tərəfə qaldırdı. O qalanın hakimi Şeyxüm mirzə qalanı möhkəmlətdi. Böyük qazilər Qərşini mühasirəyə aldılar. Müzəffər döyüşçülərin top və tüfəng zərbələrindən qalanın bürcündə və divarında deşiklər açıldı. Qızılbaş ordusu şəhərə daxil olub fəth və zəfər bayrağını dalğalandırdı. Şeyxüm mirzə taleyin pəncəsində əsir oldu. Qətliam haqqında ali hökm verildi. On beş min nəfərə yaxın kiçik və böyük, gənc və qoca qətlə yetirildi. O vilayətin seyidləri arvad-uşaqları ilə birlikdə cümə məscidinə pənah apardılar və Əmir Məhəmməd Yusifin yanına adam göndərib [dedilər]: “Biz Mürtəzavi xanədanına mənsubuq (Həzrət Əlinin nəslindənik). Yəqindir ki, qızılbaş əsgərləri özlərini Heydəri-Kərrarın[1743] aşiqlərindən sayırlar. Sənə layiq olan budur ki, bizim əhvalımızı Əmir Nəcmə ərz edib arvad-uşağımızı qətldən qurtarasan”. Əmir Məhəmməd, Əmir Nəcmin yanına gedərək seyidlərin qanlarının bağışlanmasını istədi. Bu xahişə cavab olaraq, o haqtanımaz üzüqara[1744] (Əmir Nəcm) Əmir Məhəmmədə söylədi:

- Qazilər hansı mülkü döyüşlə tutsalar, onların kiçiyini və böyüyünü qətlə yetirərlər, seyid olanlarla olmayanlar arasında fərq qoymazlar.

O pozğun cahildən bu sözü eşidən qızılbaş əsgərləri məscidə girib seyidlərin hamısını arvadları və uşaqları ilə birlikdə öldürdülər.

Ondan sonra [Əmir Nəcm] Babur padşah və dövlətsevər əmirlərlə birlikdə Buxaraya yönəldi. Çünki Übeyd xan və Canibəy sultan o şəhərdə idilər və öz ürəklərinin lövhəsində qarşıdurma və vuruşma nəqşini çəkmişdilər. Əmir Nəcmi-Sani Buxaranın iki fərsəxliyinə çatanda eşitdi ki, Şeybək xanın oğlu Teymur sultan və Kuçum xanın oğlu Əbu-Səid sultan həddən çox ordu ilə Səmərqənddən çıxmışlar. O, Bayram bəy Qaramanlunu onları dəf etmək üçün göndərdi. Qazilərin hərəkətindən agah olan özbəklər Qicdüvan[1745] qalasına çəkilib orada möhkəmləndilər. Əmir Nəcmi-Sani səadət və bəxtiyarlıqla qala ətrafına gəlib onları mühasirəyə aldı. Teymur sultan və Əbu-Səid sultan öz adamlarının bir qismini qazilərlə savaşmaq üçün [qaladan] bayıra göndərdilər. Döyüş gününü zifaf gecəsinin ləzzətindən üstün tutan bir dəstə qızılbaş dilavəri tam vaxtında onlara yetişdilər və hərb meydanının toz-torpağını yuxarı qaldırdılar. Hər [iki] tərəfdən bir sıra ölənlər və yaralananlar oldu. Talesizlik tozu bədkirdar özbəklərin başlarına səpildi və onlar qalaya tərəf qaçdılar. Hər gün çöhrəsi işıqlı günəş asiman şəhristanını zəbt etmək əzmi ilə ağ bayrağını qaldırdığı vaxtdan ta ulduzların məşəli fələk qalasının bürcü üzərində yanmağa başladığı zamanadək böyük qazilər qantökən qılıncları qından sıyırıb düşmənlərə hücum edirdilər. Özbəklər də ölüm oxu ataraq cavab verirdilər. Bir neçə gün aləmi yandıran qoşun qaragün özbəklərlə vuruşduqdan sonra Nəcm bəyin ordusunda azuqə azaldı. Babur padşah Nəcm bəyə dedi:

- Bu qış [mövsümündə] Qicdüvan qalasını mühasirədə saxlamağın bir faydası olmayacaq. Münasib odur ki, buradan qayıdış təbili vurub Qərşi ətrafında qışlaq edək. Beləliklə, Bəlx şəhərindən ordubazar əhli müzəffər orduya taxıl və ərzaq gətirsin. Elə ki qış başa çatdı və özbəklərin azuqəsi tükənməyə başladı, o zaman biz yeni bir güclə və əndazəsiz bir qoşunla onların qalalarının və şəhərlərinin üzərinə gedərik.

Əmir Nəcm [bu təklifi] qəbul etməyib dedi:

- Sabah sultanlara layiq bir döyüş edəcəyik.

Yekşənbə günü, ramazan ayının 3-də (12.11.1512)[1746], səhər vaxtı özbək qoşununun mənqəlayı Qicdüvan ağaclarının arasından görünməyə başladı. Bu vəziyyətin səbəbi o idi ki, Buxarada olan Übeyd xan və

---

[1741] Bu, Xüzar qalasıdır. Xüzar qalası – Özbəkistanın cənubundakı Qaşqadərya vilayətində, Qərşi şəhərindən cənub-şərq tərəfdə yerləşən indiki Quzar şəhəridir.

[1742] Qərşi – indiki Özbəkistanın Qaşqadərya vilayətinin inzibati mərkəzi olan və Buxaradan 150 km. cənub-şərqdə, Qaşqadərya çayı sahilində yerləşən Karşi şəhəri.

[1743] Heydəri-Kərrar (hücum edən aslan) – Həzrət Əlinin ləqəblərindən biri.

[1744] Məclis nüsxəsi: “zalım və haqtanımaz kəndli”; Bakı nüsxəsi: “haqtanımaz kəndli”.

[1745] Qicduvan – Özbəkistanda, Buxaradan 40 km. şimal-şərqdə yerləşən şəhər.

[1746] Həmin tarix cümə gününə təsadüf etmişdir.

Canibəy sultan Qicdüvan ətrafında Əmir Nəcmin işinin çətinə düşdüyünü eşidib, döyüşə girməyi qərara alaraq, hamısı döyüşkən kişilər olan piyada və süvarilərdən ibarət çoxlu qoşunla Qicdüvana doğru sürətli yürüşə çıxmışdılar. O hüduda gəldikdən sonra qalada olan Əbu-Səid sultan və Teymur sultan onlara qoşulub hərb meydanına üz tutdular. Qızılbaş əmirləri Əmir Nəcmlə aralarında olan ədavət səbəbindən elə həmin zaman köç edib Xorasana yönəldilər. Nəcm bəy və Bayram bəy az adamla özbəkləri qarşılamağa getdilər. Bu zaman Übeyd xanın adamlarından bir dəstə qızılbaş qoşununun sol cinahına həmlə etdi. Bayram bəy Qaramanlu öz adamları ilə o pis inanclı camaatı dəf etmək üçün meydana tələsdi və hərb əsnasında birisinin atdığı oxla yerə sərildi. Özbəklərin hamısı birdən irəli atıldılar və Nəcm bəyin qoşunlarını məğlub edib, onu əsir tutaraq Übeyd xanın yanına apardılar. Onun işarəsi ilə öldürüldü. Qaçış zamanı qazilərdən bir çoxları Amudərya çayında batdılar. Babur padşah Hisari-Şadmana yollandı.

Özbək sultanları sərəncamları altında yaraq-əsləhəli və çoxsaylı qoşunun olduğunu görüb Xorasan vilayətini ələ keçirmək fikrinə düşdülər. İlk öncə Canibəy sultan Ceyhundan[1747] keçib Herata doğru hərəkətə gəldi və Kəhdəstan çəmənində dayandı. Gicdüvan vuruşmasından böyük çətinliklə qurtulmuş Hüseyn bəy Lələ və Əhməd bəy Sufioğlu Heratın bürcünü və divarını möhkəmlətdilər. Əhməd bəy Sufioğlu, İxtiyarəddin qalasını mühafizə etdi. Hüseyn bəy Lələ, Mirzə Sultan Əhməd bürcünü qorudu. Əmir Qiyasəddin Məhəmməd, Məlik darvazasını möhkəmləndirdi. Əmir İmadəddin Mahmud, Firuzabad darvazasında mövqe tutub bayraq ucaltdı.

Canibəy sultanın adamları iki dəfə Baği-Sefid (Ağ bağ) tərəfdən xəndəyə yaxınlaşsalar da, qazilərin ox zərbəsi ilə yaralanıb geri döndülər. Daha üç-dörd dəfə Firuzabad darvazası istiqamətindən döyüşə atıldılar və Əmir İmadəddin Mahmudun mülazimləri tərəfindən ağır yaralar alaraq məğlub oldular. Toqquşmaların birində Baba Eşqi Təbərrayi[1748] özbəklərin əlinə düşdü. Onun həyat dəftərinin vərəqləri yoxluq küləyinə verildi (öldürüldü). Bu hadisələr cərəyan edən vaxt Übeyd xan Heratın ətrafına çatdı və Saq-Salman kəndində məskən saldı. Onun adamları neçə dəfə küçəbəndin yaxınlığına gəlib böyük döyüşlər etsələr də, bir iş görə bilmədilər. İki ay müddətində o iki azğın sultan Herat ətrafında oturdular və həmin il tarla məhsulu yaxşı bar vermədiyi üçün şəhər əhalisi arasında qıtlıq özünü göstərdi.

### İsgəndər şanlı xaqanın Nurəli xəlifə Rumlunu Ruma göndərməsi, o hüdudun və o ölkənin xarab olması haqqında söhbət

Bu il Rum vilayətində iğtişaşın baş verməsi xəbərini alan İsgəndər şanlı xaqan sədaqət şüarlı sufilərin toplanması üçün Nurəli xəlifə Rumlunu o diyara göndərdi. Xəlifə Qarahisara[1749] çatanda Rum sufilərindən və o diyarın müridlərindən təqribən üç-dörd min nəfər süvari öz ailələri və köçləri ilə birlikdə ona qoşuldular. Xəlifə onlardan cəsarət alıb Malatyaya[1750] doğru hərəkətə gəldi. Sultan Səlim tərəfindən o diyarın hakimi olan Faiq bəy bu hadisədən xəbər alan kimi üç min süvari ilə ona qarşı döyüşə tələsdi. Toqat mövqeyində hər iki qoşun bir-biri ilə qarşılaşıb döyüşə başladılar. Nəticədə, xəlifə qalib gəldi. Rumilər döyüş meydanından qaçış vadisinə tələsdilər. Qazilərin və sufilərin əlinə çoxlu mallar keçdi. Şəhər əhlindən bəziləri xəlifənin hüzuruna gələrək şərəfləndilər və şəhərdə İsgəndər şanlı xaqanın adına xütbə oxudular. Ona görə də xəlifə onlara zərər verməyib Adinə-bazarına[1751] yönəldi və oradan keçib Qaz-çayırında dayandı. Burada Sultan Bayəzidin oğlu *Əhmədin oğlu*[1752] Sultan Murad on min nəfərlə Sultan Səlimin qoşunundan fərar edib xəlifəyə qoşuldu. O iki xoşbəxt bir-biri ilə ittifaqda Toqat şəhərinə yollandılar. Bu dəfə şəhər əhalisi müxaliflik

[1747] Məclis nüsxəsi: "Amuyə çayından" (Amudəryadan).

[1748] Təvəlla və təbərra – şiə əqidəsinə görə, vacib dini əməllərdən bəhs edən füruiddinin 10 prinsipi sırasına daxildirlər. Təvəlla Məhəmməd peyğəmbərin Əhli-beytinin dostları ilə dost olmağı, təbərra isə Əhli-beytin düşmənləri ilə düşmən olmağı nəzərdə tutur. Təbərradeyənlər (təbərrayilər) – Səfəvi dövründə sünniliyin əsaslarını sarsıtmaq üçün ictimai yerlərdə ilk üç xəlifəni, yəni sünnilərin pərəstiş etdikləri Əbu-Bəkri, Öməri, Osmanı ucadan lənətləyən xüsusi qrup idi (daha ətraflı bax: *Rosemary Stanfield-Johnson. The Tabarra'iyan and the Early Safavids // Iranian Studies; March 2004; Volume 37, No. 1, p.47 -71*).

[1749] Nuruosmaniyyə və Ellis nüsxələri: "Qələ-Hisar" (Qoylu-Hisar).

[1750] Burada bir yanlışlıq vardır. Çünki Malatya o zaman Məmlüklərin əlində idi.

[1751] Bakı nüsxəsi: "Ayna-bazarı". Tokat vilayəyinin Pazar ilçəsi nəzərdə tutulur *(N.Musalı. Safevî kaynaklarına göre Tokat // Gaziosmanpaşa Üniversitesi Tokat Tarihi ve Kültürü Sempozyumu (25-26 Eylül 2014). Bildiriler. I. c. Tokat, 2015, s.570)*.

[1752] Bakı nüsxəsi (76b).

göstərdi. Qazilər şəhəri yandırıb Niksər[1753] şəhərinə yönəldilər. Sultan Murad, xəlifədən ayrılıb İsgəndər şanlı xaqanın dərgahına yollandı. Xəlifə qazilərdən bir dəstəsini həsənlü[1754] tayfasını çapıb-talamağa göndərdi. Onlar bu işi icra edib, hədsiz mallar və yeni qələbələrlə xəlifənin ordusuna qayıtdılar. Xəlifə Ərzincana yönəldi. O qazi əmir Eyüyazı mövqeyinə çatdıqda xəbər gəldi ki, Sinan paşa, Hüseyn bəy[1755] və Tacəddin bəy yaxşı silahlanmış on beş min süvari ilə zəfər şüarlı qoşunun ardından yetişməkdədirlər. Xəlifə geri dönüb onların qarşısında səf qurdu. O, bir dəstə bahadırı çərxçı [təyin] etdi. O tərəfdən Rum əmirləri də təpəyə çıxıb, qoşunlarını tərtib etməklə məşğul olaraq irəli çapdılar və çərxçiləri mərkəzə doğru sıxışdırdılar. Xəlifə savaş meşəsinin aslanlarından və döyüş dağının pələnglərindən bir dəstə ilə özünü düşmənlərə vurdu. İti qılıncdan hərb atəşi alovlandı. Atəş saçan xəncərin şimşəyindən döyüşçülərin sinəsi kömür kimi yandı. Sonuncu namazdan (ikindi vaxtından) axşama qədər canla bədən, oxla cövşən arasında qovuşma və ayrılıq, vüsal və fəraq baş verdi.

Şeir

“Əcəl can ilə aşina oldu,
Bədənlə can bir-birindən ayrıldı”.

Qızılbaş qoşununun hərəkətlərindəki igidlik əlamətlərini görən Sinan paşanı qorxu bürüdü və o, günəşin batdığı vaxtda ürəyi atəşlə və gözü yaşla dolu bir halda qaçış yolunu tutdu. Qazilərin hər biri əlində can odlayan nizə və barmağında qan tökən ox tutmuş halda qaçanların ardınca düşdü. Onlar Sinan paşanı min beş yüz nəfərlə birlikdə qətlə yetirdilər. Rumilərin bədbəxtliklərindən biri də o oldu ki, o gecə qaçış əsnasında qurumuş bir çaya çatdılar və elə həmin an böyük bir təpə onların başına aşdı. Belə ki, min beş yüz nəfər onun altında qaldı. O qələbədən sonra [Nurəli xəlifə] etibarlı adamlar vasitəsilə rumilərin başlarını bol-bol qənimətlərlə birlikdə İsgəndər şanlı xaqanın dərgahına göndərdi, özü isə ona tiyul olaraq verilmiş Ərzincanda qaldı.

**Ölümlər**

Bu il yeniçəri camaatı Rumda ittifaq edərək Sultan Bayəzid ibn Sultan Məhəmməd ibn Sultan Murad ibn Sultan Məhəmməd ibn İldırım Bayəzid ibn Sultan Murad ibn Orxan ibn Osman ibn Ərtoğrulu hakimiyyətdən uzaqlaşdırdılar və onun Trabzon hakimi olan oğlu Səlimi İstanbula[1756] gətirib səltənətə əyləşdirdilər. O, bu qüssədən xəstələnib bu qəm evindən (dünyadan) köçdü. Cami “Silsilətüz-zəhəb” (“Qızıl silsilə”) kitabını onun adı ilə zinətləndirmişdir. Bu beytlər o cümlədən onun mədhinə aiddir:

Şeir

“Kaş Nuşirəvan indi olaydı,
Onun ədaləti əvvəlkindən daha artıq olardı.
O, ədalət iddiasında olmaqdan utanaraq,
Rum xosrovuna kölə olardı.
İzzət və ululuq yayan sultan,
Dövran şahı Bayəzid İldırım”.

Onun zamanında Rum əhli çoxlu məğlubiyyətlə üzləşmişdir. Xüsusən də Misir qoşununa qarşı. Səltənətinin müddəti otuz iki il olmuşdur. Onun ölümündən sonra oğlu Sultan Əhməd Anadoluda öz adına xütbə oxutdu. Sultan Səlim dərgah paşalarının dilindən [ona] bu məzmunda məktublar yazdı: “Əgər o həzrət az adamla özünü İstanbula yetirərsə, biz bəndələr xidmət kəmərini canımızın ortasına bağlayıb Sultan Səlimi tutacağıq və sizi padşah edəcəyik”. O sadəlövh buna aldandı və öz oğlu Sultan Muradı qoşunun arasında qoyub özü beş yüz süvari ilə İstanbula yönəldi. Sultan Səlim çoxsaylı bir dəstə ilə onu qarşılayıb qətlə yetirdi və ondan sonra Sultan Muradı dəf etmək üçün çoxlu qoşun göndərdi. Sultan Murad məğlub olub İsgəndər şanlı xaqana pənah gətirdi. O, hökmdar ordusunda təbii əcəllə vəfat etdi.

---

[1753] Tehran nəşrində yanlışlıqla “Nikşəhr” yazılmışdır. Biz Bakı əlyazması (v.76b) əsasında düzəliş edərək doğru variantı (Niksər) yazdıq. Niksər – Tokat vilayətinin bugünkü Niksar ilçəsidir.
[1754] Bakı nüsxəsi: “Şeyx-xilu” (?).
[1755] Məclis nüsxəsi: “Həsən bəy”.
[1756] Baroda nəşri: “İslambol”.

Həmçinin bu il illərlə Ağqoyunlu sultanlarının və İsgəndər şanlı xaqanın vəziri olmuş Əmir Zəkəriyya Xorasanda vəfat etdi.

Həmçinin bu il təkbaşına vəzir olan[1757], hər gün mətbəxində ziyafət üçün yüzə yaxın qoyun sərf edilən və həmişə yemək bişirilməsi üçün mətbəxində on üç[1758] ədəd saf gümüş qazan asılan Nəcmi-Sani ləqəbli Əmir Yar Əhməd İsfahani, Übeyd xanın hökmü ilə öldürüldü.

Yenə də bu il Mövlana Bənnayi [öldü]. Onun adı Şirəli idi. Musiqi elmində və təsəvvüfdə tam bilik sahibi idi[1759]. Sultan Hüseyn mirzənin səltənəti zamanında Əmir Əlişirdən inciyib Azərbaycana, Sultan Yaqubun yanına getdi. Bir müddət sonra yenidən Xorasana qayıtdı. [Lakin] təkrarən acığı tutdu, Səmərqəndə yollanıb Sultan Əli mirzə ibn Sultan Əhməd mirzə ibn Sultan Əbu-Səid mirzənin hüzurunda qaldı və heratlıları[1760] onların öz dili ilə həcv[1761] etdi. Bu beytlər oradandır:

Şeir

“Necədir sənin halın, əhvalın, lələcan?
Xoşsan, yaxşısan və qoyunsan, ey böyük adam!
Xəşil kimi görünürsən, ey ağa, ey əmir,
Necədir halətin sənin xocacan?
Sən hüsn çovqanı ilə aparacaqsan,
Axırda gözəllik topunu meydandan.
Sənə bir yaylıq göndərdim,
Onunla üzünü örtəsən deyə.
Sənə bir təngə pul xərclədim,
Bu xərclərdən çəkinmədim”.

Şeybək xan Səmərqəndi istila etdikdə Bənnayi onun məclis yoldaşı oldu. Şeybək xanın qətlindən sonra onun oğlu Teymur sultanın xidmətində oldu. Bu il Əmir Nəcmi-Sani Qərşidə qətliam törədən zaman Mövlana Bənnayinin ömür binası qazilərin qılıncı ilə alt-üst oldu. Mövlana həyatının axırında Xoca Hafiz Şirazinin divanını araşdırmış və Hali təxəllüsündən istifadə etmişdir.

## 919-CU İLDƏ (09.03.1513 – 25.02.1514) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın ikinci dəfə Xorasana qoşun çəkməsi və Übeyd xanın fərar etməsi[1762]

Bu il, Novruzun ilk gününə təsadüf edən məhərrəm ayıın 3-də (11.03.1513) Übeyd xanla Canibəy sultan arasında ixtilaf yarandı. Onlar Herat ətrafından köç edib öz ölkələrinə yollandılar. Canibəy sultan Ceyhundan keçərək Kərminəyə[1763] getdi. Amma o günlərdə Teymur sultan çayın bu tayına gəlib Mürğab hüdudunda Übeyd xanla birləşdi və onu Buxaraya getməkdən daşındırdı. Onlar birlikdə Məşhədə gəldilər və İsfərayinədək [yerləri] öz hakimiyyətləri altına aldılar. Bu xəbər Herata çatdıqda, Hüseyn bəy Lələ və Əhməd bəy Sufioğlu şəhəri tərk edib Təbəs tərəfdən İraq və Azərbaycanın yolunu tutdular. Teymur sultan sürətli yürüş edərək Herata çatdı, Murad bağında məskən salıb təbərrayilərdən bir çoxlarını qətlə yetirdi və Xorasan üzərində hakimiyyət sevdasına könül verdi.

Bu xəbər dənizin və qurunun xaqanına yetişdikdə çoxlu ordu ilə özbəkləri dəf etmək üçün İsfahan şəhərindən Xorasan tərəfə yollandı. Kalpuş[1764] yaylağı şan-şövkətli və müdrik hökmdarın dayanacaq yerinə çevrildikdə, dostlara nəvaziş göstərən xaqanın fərmanına uyğun olaraq, Xəlil sultan Zülqədər qələbə nişanlı məiyyətdən öncə Şiraz qoşunu ilə İmam Rzanın – ona salam və dua olsun – müqəddəs Məşhədinə hərəkət et-

---

[1757] Məclis nüsxəsi: “Nəcm Zərgərdən sonra vəkil və etimadüddövlə olan”.
[1758] Məclis nüsxəsi: “on beş”.
[1759] O, həm də şair idi *(Nəvai, şərhlər, s.1071).*
[1760] Məclis nüsxəsi: “xorasanlıları”.
[1761] Həcv – hansısa bir şəxsin yaramazlıqlarını, mənfi xüsusiyyətlərini kəskin formada tənqid etmək, ona qarşı kin və nifrət bildirmək üçün yazılan satirik şeir növü.
[1762] Baroda nəşri: “Özbək xanlarının Xorasana gəlməsi, İsgəndər şanlı xaqanın Xəlil sultan Zülqədəri göndərməsi, onların (özbəklərin) Buxaraya qaçması və İsgəndər şanlı xaqanın ikinci dəfə Xorasana getməsi”.
[1763] Kərminə – Canibəy sultanın mülkü idi. Bu yer Buxara ilə Səmərqənd arasında yerləşir *(Seddon, şərhlər, s.244).*
[1764] Baroda nəşri: “Kəlapuş”; Məclis nüsxəsi: “Kələpuş”. Kalpuş – Gürgan çayından cənubda yerləşir *(Seddon, şərhlər, s.245).*

di və [şəhərin] bir fərsəxliyinə çatan zaman Übeyd xan müqavimətə tab gətirməyib Buxaraya tərəf yola düşdü. Teymur sultan da bu qiyamətin yaxınlaşmasını görüb, qaçmağı qərara alaraq Səmərqəndə yollandı.

Şeir

“Lovğa xanlar gördülər ki,
O aslan yenidən meşəyə doğru gəlir.
Elə ki aslanlar meşəyə girdi,
Onlar Turana doğru at çapdılar”.

[Dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin padşahı hələ Kalpuş yaylağında olarkən Xorasan diyarında özbəklərdən heç kimsə qalmamışdı. Teymur sultanın fərarından sonra özbək sultanlarının tərəfdarlarından olan Əbülqasım Bəxşi iki min atlı ilə Badğisdən Herata gəldi. Şəhər əhalisi hiddətlə ona müqavimət göstərdi. Dava əsnasında müzəffər bayraqlı ordunun mənqəlayı olan Piri sultan Rumlu düşmənləri məhv edən qazilərdən [ibarət] bir dəstə ilə Sərəfraz bağında döyüş meydanına yetişib o bədbəxtin tabeçilərindən təqribən üç yüz nəfəri qətlə yetirdi və Əbülqasım Qərcistan tərəfə qaçdı. İsgəndər şanlı xaqan Xəbuşandan Radkan çəməninə (Üləngi-Radkan) gəldi. Orada özbək ordusunun qorxusundan Mərvi qoyub fərar etmiş Mərv hakimi Dədə bəyin bığını-saqqalını qırxdılar, başına kələğayı örtdülər, üzünə qadın parfümeriyası (“sefidab” və “ğazə”) sürtdülər, onu eşşəyə tərsinə oturtdular, dəf və ney çalaraq zar-zar (ağlada-ağlada) ordubazarda gəzdirdilər ki, digərlərinə ibrət olsun.

Şeir[1765]

“Üzdə bığ-saqqal olmayandan sonra,
Arvadla kişinin arasında fərq olmaz.
İbrət üçün üzündən bığ-saqqalı qırxdılar,
O məclisdə onun abır-həyasını apardılar.
Gəlin kimi oldu onun camalı,
Qadınlar kimi ona kələğayı örtdülər.
Başında kətan parça, üzü qəhbələr kimi oldu,
Lakin o, saçı kəsik bir qəhbə idi.
Döyüş günü qorxudan saralan üzü,
Qırmızı pudra ilə qızartmaq gərək.
Əgər bir kişi qeyrətsizlikdən[1766] üzüqara olarsa,
Ona ağ qadın paltarı üzrxah olar”.

Ondan sonra fələk şövkətli ordu Badğis tərəfə yola düşdü. O hüduda çatdıqdan sonra belə məlum oldu ki, o diyarın əhalisi Nəcm bəylə [birlikdə iştirak etdikləri] döyüşdən fərar etmiş qazilərə çox əziyyət vermişlər və bəzilərini qətlə yetirmişlər. Ona görə də [onların] qətliam edilməsi haqqında qəzavü-qədər kimi cərəyan edən fərman verildi. Çuxa sultan Təkəlü bir dəstə qazi ilə o cahilləri qətlə yetirməyə yollandı və onların böyüyünü-kiçiyini cəzalandırdı.

Şeir

“İnsanların sayı azaldı orada,
O nahiyədə pəri (kabus) kimi qəhətə çıxdı adam”.

İsgəndər şanlı xaqan həmin yay mövsümünü Babaxaki çəmənində (Ülengi-Babaxaki) keçirdi. O, Div sultanı Bəlxə hakim göndərdi. Əndixud sakinləri zəlalət əhlindən Qara Buqal adlı birisini özlərinə hakim edib müxaliflik etməyə başladılar. Div sultan onları qətlə yetirib, Qara Buqalı tutaraq aləmin pənahı olan dərgaha göndərdi.

Həmçinin o zaman Şahrux bəy Əfşar ali mənşəli xaqanın fərmanı ilə Qəndəhar tərəfə sürətli yürüş edib, o vilayəti qarət edərək sağ-salamat və qənimətlərlə birlikdə göy üzü qədər uca dərgaha qayıtdı.

Xorasanın işləri cahan şahının istəyinə uyğun şəkildə həll edildikdən sonra o, Herat hakimliyini Zeynal xan Şamluya verib Babaxakidən qayıdış bayrağını İsfahana doğru yüksəltdi və həmin şəhərdə qışlaq etdi.

---

[1765] Məclis nüsxəsi: “Həcv”.
[1766] Baroda nəşri: “izzətsizlikdən”.

**Sultan Heydər Səfəvinin oğlu Sultan[1767] Süleymanın İsgəndər şanlı xaqan həzrətlərinə qarşı müxaliflik etməsi və nankorluğa düçar olması haqqında söhbət**

Bu qışda Sultan Heydərin oğlu Seyid Süleyman, İsgəndər şanlı xaqana qarşı müxaliflik izhar etdi. Onun başına çoxlu adam toplaşdı və dedilər:

- Zamanın xaqanı Xorasana getmiş və Azərbaycandan uzaq düşmüşdür. Fürsəti qənimət bilib Təbrizi ələ keçirmək lazımdır.

Seyid Süleyman o əbləhlərin sözünə aldanıb, təkəbbür və lovğalıq buxarının beyninə girməsinə yol verərək qiyam hazırlıqları gördü. [Amma] bu beytlərin məzmunundan xəbərsiz idi o:

Şeir

"Vəlinemətinə qarşı çıxsan əgər,
Asiman da olsan, alt-üst olarsan".

O, bir dəstə fitnəkar adamla Təbriz üzərinə sürətli yürüş etdi. Elə ki bu xəbər Təbriz hakiminə çatdı, o, şəhərlilərlə birlikdə küçələri nəzarət altına alıb [yollara] su buraxdı ki, yer buz bağlasın və süvarilərin irəliləməsi çətinləşsin.

Seyid Süleyman çoxlu qoşunla şəhərin əsas küçəsinə (xiyabana) daxil oldu. Təbrizin qara camaatı davaya başlayıb, xiyabanın divarlarından deşik açaraq o bədbəxtləri ox və tüfəng zərbəsi ilə məğlub etdilər. Seyid Süleyman bol kədərlə Acısuya (Abi-Şor) yönəldi. Qara camaat gözlənilməz bəla kimi Şənbi-Qazanda onlara çatdı. Seyid Süleyman tərəfdarları da qarışqa və ilan (həşəratlar) kimi döyüş səfi tərtib etdilər. Təbriz yetimləri (yoxsulları) iti qılınc zərbəsi ilə qiyamət gününü zahir etdilər və Seyid Süleymanı atdan aşırdılar. Buna baxmayaraq, Seyid Süleyman özü gənclərdən və yaşlılardan on altı nəfəri ox zərbəsi ilə yaraladı. O əsnada həmin vaxt qorçu olan Məntəşa[1768] sultan Ustaclu özünü ona yetirib qılınc zərbəsi ilə həlak etdi.

Bu il Mövlana Sultanəli əbədiyyət aləminə köçdü. Hüsni-xətdə elə bir səviyyəyə çatmışdı ki, qədim və yeni xəttatlardan heç kəs o səviyyəyə çatmamışdır.

Şeir

"Dünyada qara qələmi ilə,
Sildi bütün ustadların xəttini.
Onun şagirdləri yəqinliklə,
Xətt[1769] yolunda olmuşlar katiblərin ən möhtərəmi".

Belə ki, bu üslubda yeni tərz və dəqiq qaydalar yaratmış Xoca Mir Əli belə ona çata bilməz.

Misra

"Bəli, heç bir əmir sultana çata bilməz".

Xəttinin rəvanlığı və gözəlliyi cahanın ətrafında hədsiz dərəcədə məşhur olan xəttat Mövlana Cəfər ləl və incilər mənbəyi olan bu sənət mühiti ilə müqayisədə Ümmanın yanındakı kiçik bir arx kimidir və asimanın müqabilindəki kiçik bir təpəyə bənzərdir. Bu sahədə günəşdən daha parlaq olan Mövlana Əzhər onunla müqayisədə Sühanın aləmi işıqlandıran günəşə nisbəti və ya Yelda gecəsinin[1770] ağ buludla dolu gündüzə nisbəti kimidir.

Qədimdə xətt olmamışdır. Onu Təhmurət (Təhmurəs)[1771] icad etmişdir. Xəttin təfsilatı budur: ibri, bərbəri, əndəlüsi, sini[1772], qibti, yunani, həmyəri, süryani, rumi, kufi, *moğoli*[1773], hindi, farsi.

Nəsx və süls xətlərinin ixtiraçısı İbn Müqlədir[1774]. Altıncı cilddə yazıldığı kimi, onun əlini kəsdikləri üçün o, [bu sənəti] öz qızına öyrətdi. Ondan sonra Əli ibn Bəvvab[1775] mühəqqəq və reyhan [xətlərini] ixtira

---

[1767] Məclis və Bakı nüsxələri: "Seyid".
[1768] Bakı nüsxəsi: "Mustafa".
[1769] Nuruosmaniyyə nüsxəsi: "haqq".
[1770] Yelda – ilin ən uzun gecəsi (dekabrın 21-dən 22-nə keçə gecə).
[1771] "Şahnamə"də adı çəkilən qədim İran hökmdarı Təhmurəs nəzərdə tutulur *(Seddon, şərhlər, s.245).*
[1772] Baroda nəşrində yanlışlıqla "seyfi" yazılmışdır. Burada "sini" yazısı adı ilə Çin yazısı nəzərdə tutulur.
[1773] Bakı nüsxəsi (80b).
[1774] Əbu Əli Məhəmməd ibn Əli əl-Hüseyn (Həsən) ibn Müqlə əl-Bağdadi (öl. 348 / 940) – xəttatlığı ilə məşhurlaşmış Abbasi vəziri *(A.Özaydın. İbn Mukle // TDVİA, cilt: 20, yıl: 1999, s.211-212).*
[1775] Əbülhəsən Əlaəddin Əli ibn Hilal əl-Katib əl-Bağdadi (öl. 413 / 1022) – məşhur xəttat *(M.Serin. İbnü'l-Bevvâb // TDVİA, cilt: 20: yıl: 1999, s.534-535).*

etdi və kitabə yazdı. Ondan sonra, əhvalı haqqında yeddinci cilddə yazılmış Abbasi xəlifəsi Müstəsimin qulamı Yaqutdur[1776] ki, onun altı şagirdinə "altı ustad" deyirlər.

Şeyxzadə Sührəvərdi – Bağdadda idi.

Ərğəvan – şərəfli doğumu İraqi-Əcəmdə baş verib. Amma Bağdadda sakin olmuşdur.

Digəri: Pir Məhəmməd – sufidir.

Digəri: Mübarəkşah Zərrinqələm – Sultan Üveysin xidmətində idi.

Digəri: Nəsrulla Təbib – Sultan Əhməd Cəlairin mülazimi idi.

Digəri: Yusif Məşhədi – Yaqutun şagirdi idi. Təbrizdə sakin olmuşdur. Seyrəfi[1777] onun şagirdlərindəndir. Hacı Məhəmməd Bəndduz isə Seyrəfinin şagirdidir. Abdulla Təbbax[1778] Xorasanda idi. Əbdülhəq Səbzəvari onun şagirdidir. Mir Əli Təbrizi[1779] nəstəliq xəttinin yaradıcısıdır. Mövlana Cəfərin[1780] şagirdlərindən olan Mövlana Sultanəli oğlu Mövlana Abdulla dövranın gözəl yazan [xəttatlarından] idi. Mövlana Əzhər nadir ustadlardan biridir. Sultan Məhəmməd Xəndan gözəl yazanlar cümləsindəndir. Sultan Məhəmməd Nur[1781], Sultan Məhəmməd İbrişimi və Zeynəddin Mahmud İraq və Xorasanın[1782] gözəl yazan [xəttatları] cümləsindəndirlər.

Mövlana Mir Əli[1783] gözəl yazanların hamısının üzərindən xətt çəkmişdir. Gəncliyi dövründə Zeynəddin Mahmudun yanında məşq etmişdir. Xəttini kamala çatdırdıqdan sonra dəfələrlə Mövlana Sultanəli[1784] ilə çəkişmişdir. Camaat mollanın (Sultanəlinin) tərəfini saxladı. Bir gün Mövlananın (Sultanəlinin) hüzuruna gəlib [onun yazdığı] üç kağız parçasını götürdü və [onun yazılarını] təqlid edib Mövlananın kağızları arasına qoydu. Mövlana (Sultanəli) çaşıb qaldı ki, görəsən, öz xətti hansıdır? Çox yoxladıqdan sonra Molla Mir Əlinin xəttini tanıdı. Mövlana Mir Əli ömrünün axırında Buxaraya getdi. Übeyd xanın oğlu Əbdüləziz sultan ona çox ehtiram göstərdi. O, həmin diyarda fani aləmdən əbədi dünyaya tələsdi. Mövlananın (Mir Əlinin) şagirdlərindən biri Xoca Mahmud Səyavuşanidir. Mövlana Mir Əli ondan inciyib bu qitəni demişdir:

Qitə

"Xoca Mahmud gərçi bir müddət,
Oldu şagirdi bu həqiri-fəqirin.
Onun təlimi üçün ürəyim qan oldu,
Nəhayət, onun xətti sahmana düşdü.
Öyrətdim ona ağlımın azlığından,
Azdan-çoxdan bildiyim hər şeyi.
Onun barəsində bir təqsirə yol verilmədi,
Gərçi o da bir təqsir etmədi.
Onun özü yaxşı və pis hər nə yazırsa,
Hamısını bu fəqirin adına eləyir".

Xoca[1785] Seyid Əhməd Məşhədi – Mövlana Mir Əlinin şagirdidir. Qasım Şadişah, Mövlana Əbdi Nişapuri, Mövlana Şahmahmud, Mövlana Dost Herati, Ustad Behzadın[1786] bacısı oğlu Mövlana Rüstəm Əli, Hafiz Babacan Türbəti gözəl yazanlar cümləsindəndirlər. Mövlana Malik Qəzvini dinin pənahı olan şahın za-

[1776] Cəmaləddin Yaqut ibn Abdulla ər-Rumi əl-Müstəsimi h. 697 / m. 1297-98 və ya 698 / 1298-99-cu ildə dünyasını dəyişmişdir *(Seddon, şərhlər, s.246).*

[1777] XIV əsr Azərbaycan xəttatıdır. Əslən Təbrizdəndir. 1341-ci ildə vəfat etmişdir *(M.Tərbiyət. Danişməndani-Azərbaycan; tərcümə: İ.Şəms, Q.Kəndli.Bakı, 1987, s.301-303).*

[1778] Baroda nəşri: "Abdulla Təbib".

[1779] Mir Əli Təbrizi – XIV əsrin ikinci yarısında Azərbaycan xəttatı.

[1780] Mövlana Cəfər – Teymurun nəvəsi və Şahruxun oğlu olan Baysunqura xidmət etmiş bir xəttatdır. Astarabadda yaşayıb-yaratmışdır *(Seddon, şərhlər, s.247).*

[1781] Baroda nəşri: "Nəmd".

[1782] Nuruosmaniyyə nüsxəsi: "İraq, Xorasan və Əcəmin".

[1783] Mövlana Mir Əli əl-Katib – Herat seyidlərindən olan XVI əsr xəttatıdır *(Seddon, şərhlər, s.247).*

[1784] Mövlana Sultanəli – məşhur məşhədli xəttat *(Seddon, şərhlər, s.247).*

[1785] Baroda nəşri: "Əmir"; Bakı nüsxəsi: "Mir".

[1786] Kəmaləddin Behzad (təqr.1450-1535/36) – məşhur miniatürçü rəssam. Heratda doğulmuş, Herat miniatürçüsü Mirək Nəqqaşın və azərbaycanlı rəssam Pir Seyid Əhməd Təbrizinin şagirdi olmuş, uzun müddət Teymuri hökmdarı Sultan Hüseyn Bayqaranın sarayında çalışmış, daha sonra Təbrizə köçərək Səfəvi sarayında xidmət etmişdir. 1522-ci ildə Şah İsmayılın fərmanı ilə saray kitabxanasının müdiri təyin olunmuşdur. Təbrizdə vəfat etmişdir.

manının gözəl yazanlarının öndəgedəni idi. O, bütün xətləri yaxşı yazırdı. Elmlərdə Mövlana Cəmaləddin Mahmud Şirazinin şagirdi idi. Bu sətirlərin müəllifi olan dəyərsiz zərrə (Həsən bəy Rumlu) "Haşiyyeyi-şəmsiyyə"ni onun yanında oxumuşdur.

Bu il Əmir İsmayıl Şənbi-Qazani fani aləmdən əbədi dünyaya köçdü. O, Mövlana Əli Quşçunun yanında elm oxumuşdu. Mövlananın Ruma gedişindən sonra Şiraza yollanıb, biliklilərin ən böyüyü olan Mövlana Cəlaləddin Məhəmmədin dərslərində iştirak etmişdi. Ömrünün müddəti altmış doqquz il idi. Əsərləri cümləsindən: "Şərhi bər füsusi-hikəm" ("Hikmət cövhərinə dair şərh").

### "Vilayət" və hidayət bürcünün ulduzu, dinin pənahı və zəfər sahibi olan Şah Təhmasibin – Allah ömrünü uzun etsin – doğumu haqqında

Bu il, çaharşənbə günü, zilhiccə [ayının] 26-da (22.02.1514) dinin pənahı və Allahın kölgəsi olan şah İsfahan mahalının Şahabad kəndində[1787] anadan oldu. İnsan surətində bir mələk səadət əlamətli qədəmini dünyaya qoydu.

Şeir

"Aləmin bəxti nurlandı uğurlu bir ulduzla,
Din mülkünün sapına dəyərli gövhər düzüldü.
Şahlıq tacının başı ucalmışdır bu gün, çünki
Məmləkət insanlarına dünən gecə bir başçı peyda olmuşdur.
Ay üstürlabda[1788] onun doğuşunun hesabını görənə qədər,
Bütün gecə Keyvan intizarla gözləməkdə idi.
Bəd nəzərdən qorunmaq üçün gecə üzərliyini yandırmaqdan ötrü,
Sübh vaxtı bu firuzə manqalda (səmada) [günəş] bir atəş yandırdı".

Yüksək rütbəli əmirlər və adlı-sanlı vəzirlər qeyri-məhdud gümüş və qızıl pullar, inci və gövhərlər sədəqə verdilər və şükranə əlamət olaraq, bir neçə günü ziyafət, şadlıq, əyləncə və rahatlıqla keçirdilər.

## 920-Cİ İLDƏ (26.02.1514 – 14.02.1515) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın Rum padşahı Sultan Səlimlə müharibə etməsi

Bu il Rum padşahı Sultan Səlim, Cəmşid səviyyəli xaqanın saray adamlarına qarşı üsyan məqamına gəldi. Onun müxalifliyinin səbəbi budur ki, Xan Məhəmməd Ustaclu Diyarbəkri istila etmiş, bir neçə dəfə zülqədər qoşununu az adamla məğlub etmiş, onun mülazimi Dəli Duraq yetmiş süvari ilə Misir padşahı Sultan Qansunun[1789] igidlikdə şöhrət tapmış və ad-san qazanmış üç yüz qulamını məğlubiyyətə uğratmışdı. Bu şücaət üzündən onun (Xan Məhəmmədin) lovğalığı, qüruru, əzəməti, cah-calalı və özündənrazılığı həddini aşdı və Sultan Səlimə təhdid və təhqirlə dolu məktublar göndərib onu vuruşmaya və qarşıdurmaya rəğbətləndirdi və təhrik etdi. Hətta ona kələğayı və s. kimi fitnə-fəsada səbəb olan bir neçə şeylər göndərdi. Digər səbəb o idi ki, Nurəli xəlifə Rumlu o diyarda çoxlu xarabalıqlar törədib Toqatı yandırmışdı. Bu hadisələr onu (Sultan Səlimi) müharibəyə sövq etdi. O, Qaraman, Anadolu, Məntəşa, Gərmiyan-eli, Kəfə, Trabzon, Semendirə, Əflaq, Bosna, Mora və Serb vilayətlərinin əsgərlərini toplayıb, ildırım kimi zərbə vuran, Yeddiqardaş (Sürəyya) ulduzları kimi dəstə bağlamış, sel kimi qorxunc, dərya kimi şövkətli olan, Adəm övladının xəyalının onun sonsuz dəstələrindən və hədsiz əsləhələrindən bir qismini belə təsəvvür etməyə aciz qaldığı və dünyanın bütün iqlimlərindəki insanların qələmlərinin onun sayını yazmağa kifayət etməyəcək qədər çoxsaylı qoşunla,

Şeir

"Ədəddə zərrədən və sayda qətrədən daha çox,
Göydəki ulduzlardan və dənizlərdəki dalğalardan daha artıq",

[1787] London nüsxəsində köhnə xətlə belə bir haşiyə qeydi vardır: "Bu, İsfahan bölüyündəki Şəhrabaddır".
[1788] Üstürlab – astronomiyada bucaqölçən alət, rəsəd alətidir.
[1789] Bakı nüsxəsi: "Qanisad".

iki yüz min[1790] nəfərə qədər süvari və piyada ilə Ərzincana yönəldi və İsgəndər şanlı xaqanın dərgahına elçi göndərib özünün savaş əzmi ilə hərəkətə başladığını xəbər verdi. Qasid Həmədanda ulu dərgaha yetişdi və Sultan Səlimin müxalifliyi xəbərini ərz etdi. O həzrət cavab verdi:

- Biz də döyüşə hazırıq və qarşılaşma yeri harada olacaqsa, orada gözləyəcəyik.

Daha sonra elçiyə rüxsət verib, Diyarbəkrə adam göndərdi ki, Xan Məhəmməd Ustaclu Diyarbəkr əsgərləri ilə ali dərgaha tələssin. O həzrət göz deşən oxu günəşin qızıl qübbəsində Sühanın gözü önünə gətirən, qaranlıq gecədə ilanın gözünü qarışqanın ürəyi ilə bir sapa düzən, xardal və xaşxaş bitkisini nizənin ucu ilə yerdən qoparan igidlərlə döyüşə yollandı.

Onlar Təbrizə gəldikdə xəbər çatdı ki, Sultan Səlim qorxusuz-hürküsüz halda köçhaköçlə irəliləməkdədir. Sahibqiran padşah qürur bazusunun gücünə güvənib arxayın və rahat şəkildə öz ailəsi və köçü ilə birlikdə köhlən atının yüyənini düşmənlərə doğru çevirdi.

Rəcəbin (22.08-20.09.1514) əvvəllərində, Təbrizdən iyirmi fərsəx aralıda yerləşən Çaldıran[1791] [adlı] yerdə o iki şövkətli qoşun bir-biri ilə qarşılaşdı. Rum sultanlarının qaydası belədir ki, müharibə vaxtı öz qoşunlarının ətrafını arabalar və zəncirlərlə möhkəmlədib özlərini qorumaq üçün çox möhkəm bir istehkam yaradarlar. Tüfəngçilər onun içində zərbzəng, top və tüfəng atmaqla məşğul olarlar. Arabanın üzərinə əjdahaya bənzər kiçik və böyük qazğanlar qoyarlar. Onlar top, tüfəng, rəadə[1792] və zərbzəng atmaqda o qədər məharətli və bacarıqlıdırlar ki, işıqda görünən çox kiçik hədəfi bir mil uzaqdan seçib dəqiq vurarlar və xəyali bir nöqtəni göz xətlərinin oxları ilə bir fərsəx uzaqdan nişan alarlar.

Xan Məhəmməd Ustaclu, Nurəli xəlifə və rumilərin vərdişlərini bilən bəzi digər şəxslər ərz etdilər:

- Düşmənlər Çaldıranda özlərini müdafiə etməyə hazır olmazdan öncə onların üzərinə gedək və o natamamların işini bitirək.

Durmuş xan Şamlu bu sözü rədd edib, Xan Məhəmmədə xitabən:

- Sənin kətxudalığın (ağalığın) Diyarbəkrdə keçər, – dedi və əlavə etdi: - Onlar özlərini qorumaq üçün əllərindən gələni edənədək gözləyərik. Ondan sonra döyüş meydanına qədəm qoyub onların qoşununu darmadağın edərik.

İsgəndər şanlı xaqan, Durmuş xanın sözünü qəbul etdi (bəyəndi). Sultan Səlim Çaldıran təpəsindən aşağı enib, öz qoşunlarının mövqeyini möhkəmləndirməyə çalışaraq öz ətrafını araba və zəncirlə bağladı.

Şeir

“Araba taxta atlar kimi işə düşdü,
Rumilər uşaqlar kimi ona mindilər.
Arabanın fil ilə oxşarlığı var idi,
Onun üzərindəki tüfənglər isə məst fillərin xortumuna bənzərdi”.

[Sultan Səlim] on iki min yeniçəri əsgərə əmr etdi ki, səfin önündə durub öz işləri ilə məşğul olsunlar. Qoşunun sağ və sol cinahlarını adlı-sanlı paşalardan Sinan paşaya, Bığlı paşa [adı] ilə məşhur olan Mustafa paşaya, Fərhad paşaya, Qaraca paşaya və Şahsüvar bəyin övladı Zülqədəroğlu Əli bəyə tapşırdı. Malqoçoğlunu çərxçi [təyin] etdi. Mixaloğlunu isə muçi[1793] [təyin] etdi. Məvacib yeyən, ilan rəftarlı və Əhrimən[1794] görkəmli yüz mindən çox süvarini hərb meydanına göndərdi.

Bu tərəfdən fələyin qulamlıq etdiyi xaqan xoşrəftar atına mindi.

Şeir

[1790] Məclis və Bakı nüsxələri: “yüz iyirmi min”.
[1791] Maku yaxınlığında düzənlik.
[1792] Odlu silah (çox güman ki, artilleriya növü) olduğunu təxmin edə bilərik.
[1793] Muçi – tədqiqatçılar bu sözün “heç bir lüğətdə olmadığını” və “hələlik onun lüğəvi mənasının aşkar edilmədiyini” yazırlar *(Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə, s.72).* Bəlkə də, bu sözü “muçi” kimi deyil, “mövci” kimi oxumaq lazımdır. “Mövc” ərəbcə “dalğa, ləpə” anlamını verir. “Mövci” isə “dalğalı, ləpəli” mənasına gəlir. “Mövc” və “axın” ifadələrinin mənaca bir-birinə çox yaxın olduğunu düşünsək, bu terminlə Osmanlı ordusunun yüngül süvari birliklərindən biri olan axınçı qoşunun nəzərdə tutulduğunu güman edə bilərik. Burada adı çəkilən Mixaloğlu ailəsi Osmanlı ordusunda axınçı komandanları kimi ad çıxarmışdır *(A.Özcan. Akıncı // TDVİA, cilt: 2, yıl: 1989, s.249-250).* Lakin hələ ki, bu barədə konkret bir fikir yürütmək mümkün görünmür. “Əhsənüt-təvarix”də bu terminə həm “muci”, həm də “muçi” şəklində rast gəlirik. Hərbi əməliyyatların təsvirindən belə başa düşülür ki, muci / muçi dəstəsi çərxçilərin arxasında yer alan öncül birliklərdən olmuşdur.
[1794] Əhrimən – atəşpərəstlikdə şər tanrısı.

“Yaxşı yeriyən ata mindi igid,
Meydana yaraşan qızğın aslan kimi.
Onun siması at üstündə elə parlayırdı ki,
Tur[1795] dağından təcəlli görünürdü sanki”.

Zəfər şüarlı xaqan sağ cinahı Durmuş xan Şamlu, Xəlil sultan Zülqədər, Hüseyn bəy Lələ, Nurəli xəlifə Rumlu və Xüləfa bəy kimi adlı-sanlı əmirlərə tapşırdı. Sol cinahda isə Xan Məhəmməd Ustaclu və Çayan sultan Ustaclu Diyarbəkr qoşunları ilə yerləşdilər. Qərara alındı ki, Əmir Əbdülbaqi, Seyid Məhəmməd Kəmunə və Əmir Seyid Şərif mərkəzdə dursunlar. Sarı Pirə Qorçubaşını qazilərin bir dəstəsi ilə çərxçi etdilər. O həzrət (Şah İsmayıl) bir dəstə qorçu ilə ehtiyatda dayandı ki, hansı tərəfdə çətinlik yaranarsa, özünü onların köməyinə yetirsin. Hamısı aslan kimi qızğın, bəbir kimi heybətli, fil kimi şövkətli olan qızılbaş qoşunu rumilərin qarşısında səf çəkdi. Bu, elə bir əzəmətli qoşun idi ki, onun qorxusundan dağ əriyərdi və onların mətanəti qarşısında asiman qalxanını salardı. Atların kişnəməsindən və ordunun fəryadından ay göydə yolunu itirdi. Kosun gurultusundan namuslu fələyin çöhrəsi senderus[1796] kimi saraldı. Can qorxusundan dilavərlərin bədəni küləyin qarşısındakı söyüd yarpağı və günəşin sudakı əksi kimi titrədi. İlk öncə Sarı Pirə Ustaclu çərxçilər dəstəsi ilə düşmən qoşununun üzərinə at çapdı və onların qoşununun mənqəlayını yerindən dəbərdib muçiyə çatdırdı. Muçilərin başçısı olan Mixaloğlu, Sarı Pirənin üzərinə həmlə edib onu geri oturtdu. İsgəndər şanlı xaqan rumilərin həmləsini müşahidə etdikdə onun qəzəb atəşi alovlandı və o, öz qəhrəmanlıqlarının gücü ilə sübhün nəfəsini axşamın sinəsində sındıran, qılınclarının təhdidi ilə günəşin xəncərini zülmət qınında gizlənməyə vadar edən dilavərlərlə onlara hücum etdi. O əsnada igidlik dənizində bir nəhəng olan Malqoçoğlu o həzrətin qarşısına gəlib, boş-boş sözlər söyləmək üçün ağzını açaraq dedi:

Şeir

“Mən döyüş və kin günündə,
Asimanı yerə vura bilərəm.
Mən bir oxla qarşıqanın gözlərini bir-birinə tikərəm,
Başqa bir oxla isə onu qüsursuz çıxararam.
Mən əgər düşmənə qəzəblə baxsam,
Şirin canını təslim edər o, zəhərli baxışımından.
Nizəm böyürdən girib göbəkdən çıxar,
Yalan söyləmirəm, budur həqiqət”.

Amma o, oxa, kamana, qılınca və nizəyə əl atmazdan öncə İsgəndər şanlı xaqan onun başına bir qılınc vurdu. Belə ki, onun dəbilqəsi başı ilə birlikdə ikiyə bölündü və [qılınc] onun boynuna çatdı. Düşmənlər ömürləri boyu belə bir zərbəni nə görmüşdülər, nə də eşitmişdilər. Onlar heyrətə düşdülər və müqayisəyəgəlməz bir qorxu içində mərkəzə qaçdılar. Qızılbaş ordusunun sağ cinahı rumilərin sol cinahına hücum etdi. Toz-torpaq və hay-küy havaya qalxdı. Hərb atəşi alışdı və bədənləri çör-çöp kimi yandırdı.

Qan saçan qılıncın şöləsi asimana dil uzatdı və nizənin atəşinin tüstüsü Keyvan eyvanına çatdı. Sinan paşanın igidliyinin öhdəsinə verilən rumilərin sol cinahı aşiqlərin ürəyi və məşuqların zülfü kimi pərişan oldu və Çaldıran təpəsinin o biri tərəfinə çəkildi. O gün Sultan Səlim üçün hicran gecəsi və ayrılıq əyyamı kimi qaranlıq və puç oldu. Sol cinahdan da Xan Məhəmməd rumilərin sağ cinahını yerindən dəbərdib mərkəzə sıxışdırdı. O əsnada bir top [mərmisi] ona dəydi və onu öldürdü[1797]. Bu səbəbdən Rum qoşunu cəsarətlənib birdən hücuma keçdi və qızılbaş ordusunun sol qolunu məğlub edərək, qoşunun ortasına çatıb onun səflərini pozdu. İsgəndər şanlı xaqan Rum çərxçilərini rumilərin əsas hissəsinə sıxışdırdıqda onlar da qaziləri tüfəng zərbəsi ilə geri oturtdular. O həzrət coşqun dənizin timsahı kimi orada iti qılıncı cövlana gətidi və qan seli Seyhun və Ceyhun çayları kimi axmağa başladı. Qan dənizi elə dalğalanırdı ki, hətta göyün yeddinci qatının qəsri Bədəxşan səlinin rəngini almışdı. Göyün altıncı qatının qazısının ağ (sincabi) rəngli kürsüsü zəfəran ki-

[1795] Tur – Sina yarımadasında dağ. Dini mətnlərə görə, burada Musa peyğəmbər Allahla danışmışdır.
[1796] Senderus və ya sandarak – bəzi ağaclardan əldə edilən sarı rəngli yağ.
[1797] Nuruosmaniyyə nüsxəsində bir haşiyə qeydi var: “Mən bəndə birbaşa olaraq, dinin pənahı olan Şah Təhmasibin gövhər yağdıran, dürr saçan dilindən eşitmişəm ki, Xan Məhəmmədi qılınc zərbəsi ilə para-para etmişdilər”.

mi qızardı, beşinci qitənin (göyün beşinci qatının) cəlladının mavi qılıncı gülzar və laləzar rənginə döndü və balığın gümüşə boyanmış cövşəni qan nəmindən qırmızı söyüd rəngini aldı.

Şeir

“Atların hamısı o qan dənizində islandı,
Dəniz atları (begemotlar) kimi hamısı üzdü.
Qandan kin çölü ümmana (okeana) döndü,
Oradakı köklər mərcan budağı oldu”.

O gün qorxmaz rumilərdən bir çoxları şərəfli padşahın qılınc zərbəsi ilə həlak torpağı üzərinə düşdülər. İgidlərin qan şərabından sərxoş olan qılınc başları kəsib yerə tökməyə başladı. Nizə canları qarət etmək üçün təcavüz əlini uzatdı. Hərçənd nizə həmlə etsə də, qalxan dözdü. Hərgah gürz qüdrətini göstərsə də, zireh təvazökarlıq nümayiş etdirdi. Qazilər güc gəlib atlarını arabalara qədər çapdılar. Yeniçərilər top və tüfəng zərbəsi ilə onları geri oturtdular. Tüfəng [gülləsi] ildırım kimi dəbilqədən, xəftandan, cövşəndən və bərgüstüvandan[1798] keçirdi və şimşək kimi savaş dəryasının girdabında atəş yandırırdı.

Şeir

“Xəncərdən, tüfəngdən və iti qılıncdan,
Hər guşədə kin bazarı qızışmış.
Döyüş və vuruşun o qızğın bazarında,
Əcəldən savayı yoxdu can satın alan”.

Qızılbaş qoşununun yaxınlığındakı bir təpəyə təqribən min yeniçəri qalxdı. Onlar da qaziləri tüfəng zərbəsi ilə yaraladılar və öldürdülər.

Şeir

“O meydanda döyüşçülər üçün,
Tüfəng noğul idi, qan isə lalə rəngli badə idi.
Tüfəng ucbatından pəhləvanlar ürəklərini əldən verdilər,
Belə bir noğuldan badəsiz məst oldular”.

O gün aləmi işıqlandıran günəş üfüq qılafından qılıncını sıyırdığı zamandan ta qızıla çalan göy qübbəsinin ortasına çatdığı vaxtadək döyüş atəşi son dərəcə şiddətləndi və alovlandı. O həzrət yeddi dəfə özünü arabalara çatdırıb qılınc zərbəsi ilə zəncirlərin halqasını kəsdi. Düşmənlər hücum çəkib onu geri oturtdular. Axırda rumilər o həzrəti əhatəyə alıb mühasirəyə saldılar. İsgəndər şanlı xaqan onların üzərinə at çapdı. Hansı tərəfə atını sürdüsə, bir bölük düşmən qoşununu qırıb yerə tökdü və hansı səmtə həmlə etdisə, ölülərdən təpə yaratdı. Onun atəş saçan qılıncı hansı döyüşçünün boynuna toxunurdusa, onu həlak torpağı üzərinə sərirdi və onun cəhənnəm odunu xatırladan həmlə atəşi hansı düşməni tapırdısa, onu cəhənnəmin bir guşəsinə göndərirdi.

Şeir

“Hansı tərəfə qılıncını vurdusa,
Biri iki etdi və ikini dörd etdi”.

Məntəşa sultan Ustaclu və başqa qorçular böyük şücaət göstərdilər. Rumilər bir daha özlərini o həzrətə yetirdilər. İsgəndər şanlı xaqan qorçularla birlikdə düşmənlərə həmlə etdi. İlan şəkilli nizə sərvərlərin başından sancdı. Atəş saçan tüfəng cövşən və zireh halqası üzərində şimşək kimi parladı. Dəbilqə dilavərlərin başı üstündə atəş kürəsi kimi isindi və dikbaşların başındakı beyin sobadakı gümüş kimi əridi. İsgəndər şanlı xaqan buyurdu ki, gərənay çalsınlar. Təxminən üç yüz süvari o həzrətin yanına toplaşdı. Ona görə də döyüşü tərk edib cilovunu geri çevirdi və [qızılbaş ordusunun] mərkəzini məğlubiyyətə uğratmış dəstə-dəstə [Osmanlı əsgərlərinin] arasına yetişərək, onların səflərini yarıb yola düşdü. Bu əsnada o həzrətin atı bataqlığa düşdü. Xızır ağa Ustaclu öz atını ona verdi və xaqan minib yoluna davam etdi. Rum qoşunları Sultanəli mirzə Əfşarı tutaraq elə təsəvvür etdilər ki, o, İsgəndər şanlı xaqandır. Onu Sultan Səlimin yanına apardılar. Başqa birisi olduğu müəyyənləşdirildikdən sonra onu qətlə yetirdilər. Rum ordusunun sol cinahını məğlub

---

[1798] Bərgüstüvan – döyüş vaxtı atlara geydirilən qoruyucu örtük.

edib arxadan dolanmış qızılbaş qoşununun sağ cinahı geri dönərək özlərini Sultan Səlimin mərkəzinə vurdular və vuruşa-vuruşa döyüş meydanını tərk etdilər. Sultan Səlim əmr etdi:

- Qızılbaş ordusunu təqib etməsinlər və heç kim qarət üçün əl uzatmasın! Çünki onlar hiylə işlədə bilərlər (onların geri çəkilmələri hərbi hiylə ola bilər).

Axşama yaxın məlum etdilər ki, orada qızılbaş qoşunundan heç kimsə qalmamışdır. Yalnız bundan sonra malları və əşyaları mənimsəməyə başladılar.

Bu vuruşmada Xan Məhəmməd Ustaclu, Sarı Pirə Qorçubaşı, Hüseyn bəy Lələ, Əmir Əbdülbaqi, Seyid Məhəmməd Kəmunə Nəcəfi və Əmir Seyid Şərif Şirazi şəhid oldular və hər iki tərəfdən beş min nəfər qətlə yetirildi ki, bunun da üç min nəfəri Sultan Səlimin ordusundan idi.

İsgəndər şanlı xaqan Dərcəzinə yönəldi və Sultan Səlim oradan (Çaldırandan) Təbrizə gəldi. Təbrizin bir sıra əyan-əşrəfi onu qarşıladı. Sultan Səlim onların hamısına izzət və ehtiram göstərdi. Ata-babası üçün qeyri-mümkün bir xəyal olan [nailiyyət] onun gözündə gerçəkliyə çevrildi. Əvvəlcə Sahibabad meydanındakı Həsən padşah məscidinə getdi və namaz qıldı. Söyləyirlər ki, xütbə padşahın adına çatdığı an xətib dedi:

- Sultan oğlu sultan, qalibiyyət sahibi (əs-sultan ibnüs-sultan, əbül-müzəffər) Şah İsmayıl Bahadır xan.

Rumilər istədilər ki, onu qətlə yetirsinlər. Sultan Səlim mane olub:

- Onun dili adət etmişdir, – dedi və əlavə etdi – Heyf o üç nəfər yüksək şanlı seyiddən ki, Çaldıran döyüşündə şəhid oldular[1799].

Səkkiz gündən sonra “Ürəklərinə qorxu saldı”[1800] [ayəsinin] möcüzəli kəlamına uyğun olaraq, İlahi lütfün köməyi ilə şahın dövləti qarşısında [Sultan Səlimin] qəlbini tamam xof bürüdü, Həmin ayın axırında o, qayıdış təbilini döyəcləyib Ruma doğru yola düşdü və Amasyada qışlaq etdi. Bu xəbər Dərcəzində zəfərə yaxın olan hökmdarın qulağına çatdıqda Təbrizə yönəldi və şaban ayında (21.09-19.10.1514) o şəhərdə yerbəyer olub qışlaq etdi.

### Burun sultan və Xoca Müzəffər Bitikçinin Məhəmməd Zaman mirzə ilə müharibə etməsi haqqında söhbət

Bu il Bədiüzzaman mirzənin oğlu Məhəmməd Zaman mirzə İsgəndər şanlı xaqanın ordusundan ayrılıb Astarabada getdi. O diyarın hakimi olan Pirqeyb bəy Talış [ona] məğlub oldu. Mirzə Məhəmməd Zaman uğurla və xoş əhvalla Astarabadda əyləşdi. O əsnada İsfərayin hakimi Burun sultan Təkəlü, Xoca Müzəffər Bitikçi ilə ittifaqda onu dəf etmək üçün yola çıxdı. Amma Sultan Səlimin Təbrizə gəlişi səbəbindən xalq arasında çoxlu şayiələr dolaşırdı və əmirlər yavaş hərəkət edirdilər. Xurşah[1801] kəndinə çatdıqları zaman varsaq [tayfasından olan] qorçu Qara Üveys xaqanın dərgahından gəldi və Sultan Səlimin çıxıb getməsi xəbərini çatdırdı. Əmirlər xoşhal olub Cürcana yollandılar və o vilayətdə Məhəmməd Zaman mirzə ilə döyüşüb onu məğlub etdilər. Mirzə Məhəmməd Zaman Qərcistana yollandı. O diyarın hakimi olan Əmir Orduşah ona qoşuldu.

### Müxtəlif əhvalatlar

Bu il Xorasanda, xüsusən Herat şəhərində qıtlıq o dərəcədə şiddətlənmişdi ki, adamlar bir-birini yeyirdilər. Oranın hakimi Zeynal xan adamyeyənləri cəzalandırdı.

Həmçinin bu il İsgəndər şanlı xaqan əmirülüməralığı Çayan sultan Ustacluya həvalə etdi, ali divan nəzarətini Mirzə Şahhüseyn İsfahaniyə lütf etdi, sədarət mənsəbini isə Azərbaycanın böyük seyidlərindən olan Seyid Əmir Abdulla Laləyə tapşırdı. Lakin adı çəkilən seyidin sədarətindən bir neçə gün keçdikdən sonra o, bu işin öhdəsindən gələ bilmədiyi üçün [sədarət vəzifəsi] Əmir Cəlaləddin Məhəmməd Astarabadiyə verildi. Diyarbəkr hakimliyini Xan Məhəmmədin qardaşı Qara bəyə lütf edib ona “xan” ləqəbi verdilər.

---

[1799] Burada Əmir Əbdülbaqi, Seyid Məhəmməd Kəmunə və Seyid Şərif nəzərdə tutulur.

[1800] *Qurani-Kərim, “Əhzab” surəsi, 26-cı ayə.*

[1801] Bakı nüsxəsi: “Xuranşah”; Baroda nəşri: “Xuzaşah”; Nuruosmaniyyə nüsxəsi: “Xuraşah”. “Həbibüs-siyər”də “Xuraşar” yazılmışdır *(Nəvai, şərhlər, s.1089).*

**Ölümlər**

Yaqub padşahın oğlu Sultan Murad - İsgəndər şanlı xaqan Bağdad üzərinə gəldiyi zaman Barik bəy Pornak onu götürüb Şama yönəldi. O, bir müddət Sultan Qansunun dövlətinin kölgəsində (himayəsində) vaxt keçirdi. Oradan Əlaüddövlə Zülqədərin yanına gedib onun qızı ilə evləndi, Həsən və Yaqub adlı iki oğlu oldu. Bu il Sultan Səlim İsgəndər şanlı xaqanla savaşa gəldiyi zaman Sultan Murad da ona qoşuldu və döyüşdə ona yoldaş olmaq istədi. [Lakin] mülazimləri bunu məsləhət görmədilər. Sultan Səlimdən ayrılıb Diyarbəkrə yollandı. Urfaya çatdığı vaxt, aslan ovlayan xaqan tərəfindən o diyarın hakimi olan Qaraca sultan[1802] qara bəxtli yaramazların hücumuna və say çoxluğuna, qələbə nişanlı və zəfər vərdişli əsgərlərin azlığına baxmayaraq, qüdrət sahibinin (Allahın) "Neçə dəfə olub ki, azsaylı dəstə çoxsaylı dəstəyə qalib gəlib"[1803] kəlamının zərurətini nəzərə alıb Sultan Muradın qarşısında döyüş bayrağını qaldırdı. İki tərəf var gücü ilə çalışıb-vuruşdu. Axırda Qaraca sultan üstün gəlib Namuradı qətlə yetirdi və onun başını və üzüyünü səadətli şahın taxtının ətəyinə göndərdi. Qaraca sultan səkkiz yüz süvari ilə səkkiz min nəfəri məğlub etdiyi üçün ona "Qudurmuş sultan" ləqəbi verildi.

Ağqoyunlu sultanlarının dövləti Sultan Muradın qətli ilə sona çatdı. Ağqoyunlulardan on üç nəfər səltənət sürmüşdür. Bu tərtiblə: Qara Osman, Əli bəy, Sultan Həmzə, Cahangir mirzə - bu dörd nəfər Diyarbəkr hakimi olmuşlar, Həsən padşah, Sultan Xəlil, Yaqub padşah, Baysunqur mirzə, Rüstəm bəy, Əhməd bəy, Məhəmmədi mirzə, Əlvənd mirzə, Sultan Murad.

Onların hamısının müstəqil səltənət əyyamı yüz bir il olmuşdur. Barik bəy Pornakın beş ildən artıq İraq hakimi olması və onun Çaldıran döyüşündə Sultan Səlimi müşayiət etməsi buraya daxil deyildir. O, Azərbaycandan qayıtdıqdan sonra kor olmuş, bir müddət sonra vəfat etmişdir. Ağqoyunlu sultanlarının məmləkətləri: İraqi-Ərəb, İraqi-Əcəm, Fars, Kirman, Azərbaycan və Diyarbəkr.

Bədiüzzaman mirzə neçə ay ali məqamlı xaqanın ordusunda oldu və cahanın müti olduğu hökmə uyğun surətdə Reydə məskunlaşdı. [Lakin] icazəsiz olaraq Astarabada gedib Şeybək xanın mülazimləri qarşısında məğlubiyyətə uğradı və Hindistana getdi. İki il o diyarda qaldıqdan sonra yenidən Xorasana, İsgəndər şanlı xaqanın xidmətinə gəldi. Qərara alındı ki, o, Təbrizin Şənbi-Qazanında sakin olsun və onun xərci üçün hər gün min dinar məbləğində [vəsait] verilsin. Bu il Sultan Səlim Təbrizə gəldiyi zaman Mirzə Bədiüzzamana böyük hörmət göstərib onu özü ilə apardı. Dörd ay sonra orada (Rumda) taun xəstəliyindən vəfat etdi.

Əmir Əbdülbaqi, Rəbbani arif Şah Nurəddin Nemətulla Kirmaninin övladlarından idi. O, öz inşası və ibarələrinin gözəlliyi ilə tay-tuşlarından üstün idi. İsgəndər şanlı xaqanın zamanının əvvəllərində sədr idi. Ondan sonra mali və mülki işlərin həlli, idarəsi, haqq-hesabı və icrası təkbaşına olaraq o həzrətə tapşırıldı. O, bu il Səlimə qarşı döyüşdə öldürüldü.

Qəzvin əsilzadələrindən olan Məlik Nəcməddin Mahmudcan Deyləmi bir müddət Yaqub padşahın vəziri olmuşdu. Daha sonra İsgəndər şanlı xaqanın vəziri oldu[1804]. Bu il o, [dünyadan] köçdü.

Şiraz hakimi Xəlil sultan Zülqədər Rum padşahı ilə döyüşdə təqsirə yol verdiyi üçün İsgəndər şanlı xaqan qorçu Kor Süleymana onun həyat xırmanını yandırmağı əmr etdi. Kor Süleyman gözlənilməz bəla kimi Şiraza gəldikdə gördü ki, Xəlil sultanın hüzurunda çoxlu adam var və yavaşca onun qulağına dedi:

- Şahın əmri belədir ki, səni on iki çubuq zərbəsi vurmaqla cəzalandırıb geri dönüm. Əgər bu məclisdə bu əmri yerinə yetirsəm, sənə qarşı hörmətsizlik olar. Yaxşısı budur ki, xəlvət bir otağa keçəsən və mən orada hökmə əməl edib geri qayıdım.

Xəlil sultan tənha şəkildə bir otağa daxil oldu. Kor Süleyman onun arxasınca gəlib onun qətli barəsində gətirdiyi hökmü göstərdi. Əqidəsinə sadiq olan Xəlil sultan müqavimət göstərməyərək iki dizi üstə çökdü. Kor Süleyman onun boynunu vurub, başını götürərək o otaqdan çıxdı və aləmin pənahı olan dərgaha yollandı. İsgəndər şanlı xaqan Şiraz hakimliyini Əli bəy Zülqədərə lütf etdi.

Əmir Seyid Şərif Şirazi, Seyid Şərif Əllamənin nəvələrindən idi. O, neçə il İsgəndər şanlı xaqanın sədri olmuşdur. Haqq məzhəbin yayılmasında tərifəlayiq səy və qeyri-məhdud cəhd zühura gətirmişdir və zə-

---

1802 Tehran nəşri: "Əçə sultan" (Aca sultan); Bakı nüsxəsi: "Aca sultan Qacar"..

1803 *Qurani-Kərim, "Bəqərə" surəsi, 249-cu ayə.*

1804 Məclis nüsxəsi: "İsgəndər şanlı xaqanın vəziri vəzifəsində Əmir Zəkəriyyə Keçəçiyə şərik oldu".

lalət yolunun yolçusu olan bir güruha qarşı mübarizədə çox çalışmışdır. Belə ki, onun məzhəbin və millətin tərəqqisindəki xidmətinin hüququ zaman səhifələri üzərində sabitdir və müqəddəs şəriətin rəvac tapmasındakı gözəl səyləri ağızlarda və dillərdə əzbərdir. [Yuxarıda] qeyd edildiyi kimi, o, bu il öldürüldü.

## 921-Cİ İLDƏ (15.02.1515 – 04.02.1516) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Sultan Səlimin Kəmax qalasını tutması

Bu il Sultan Səlim hərəkət bayrağını Kəmax qalasına tərəf yüksəltdi. İsgəndər şanlı xaqanın tərəfindən o qalanın kutvalı olan Yusif bəy Varsaq [qalada] qalmağı məsləhət bilmədi və öz mülazimi Məhəmməd bəy Varsağı üç yüz nəfərlə orada qoyub hökmdarın dərgahına yönəldi. Sultan Səlim sayı yağış damlalarından artıq olan izdihamlı ordu ilə qala ətrafına gəlib qazilərin yanına elçilər göndərdi və bildirdi:

- Münasib olan odur ki, sultanın lütfkarlığına etimad göstərib tabeçilik əli ilə qala darvazasını açasınız və beləliklə, qiyamət əlamətli qoşunumuzun hücumundan qurtulub səadətli ordumuzda həyatınızı davam etdirəsiniz.

Varsaq camaatı dedi:

- Axı necə ola bilər ki, vəlinemətimizə (ağamıza) azacıq məğlubiyyət üz verdi deyə o ali məqamlı padşahın bizim üzərimizdəki haqqını danaq və bizə əmanət olaraq tapşırdığı qalanı xəyanət əhli kimi sizə təslim edək?!

Elçilər eşitdiklərini Sultan Səlimə çatdırdılar. Onun qəzəb atəşi şölələndi və o, ata mindi. Əsləhə qurşanmış təqribən yüz min Rum süvarisi coşqun və hay-küylü bir şəkildə onun önündə irəlilədilər və qalanın yanına gəldilər. Əmr olundu ki, yeniçərilər döyüşə başlasınlar. Rum ordusu hər tərəfdən hücuma keçdi. Bir dəstə yeniçəri qala ətrafındakı bir təpəyə çıxdı və qaladakılara tüfəng atmağa başladı.

Şeir

“Tüfəng tüstüsündən tutuldu günəş və ay,
Fələyin fəzası hamam sobası kimi qaraldı”.

Varsaq qaziləri və ləyaqətli igidlər ox və daşa əl atdılar. Rumilər qalanın bürclərini yerlə yeksan edib qalanı zorla və güclə ələ keçirdilər. Qazilər məscidə pənah apardılar. Rumilər onların üzərinə getdilər. Varsaqlar qılınclarını çəkib məsciddən bayıra çıxdılar, bacardıqları qədər döyüşdülər və hamısı mərdliklə öldülər. Amma Sultan Səlim qalanı öz adamlarına tapşırıb Əlaüddövlə Zülqədərin üzərinə yollandı.

### Mustafa paşa Bığlı Çavuşun Nurəli xəlifə Rumlu ilə müharibə etməsi haqqında söhbət

Bu il Sultan Səlim tərəfindən Trabzon hakimi olan və *Bığlı Çavuş kimi tanınan*[1805] Mustafa paşa çoxlu qoşunla və qaniçən rumilərlə Ərzincana yönəldi. Nurəli xəlifə Rumlu onun hərəkətindən xəbərdar olan kimi, Məhəmməd bəy Ayqutoğlu ilə birlikdə hərəkət bayrağını o səmtə yüksəltdi. Müzəffər əsgərlər Çəmişkəzək[1806] ətrafına çatdıqda, Bığlı Çavuş coşqun və hay-küylü qoşunla görünüb qazilərin qarşısında ordu səflərini tərtib etdi. Nurəli xəlifə yaxşı silahlanmış səkkiz yüz süvari ilə sayca on mindən çox olan divə bənzər rumilərin mərkəzinə hücum etdi və nizənin ucu ilə onların bir qisminin mövcudluq naxışını varlıq səhifəsindən sildi. Axırda rumilər qalib gəldilər və Nurəli xəlifəni qətlə yetirdilər. Ayqutoğlu isə bir dəstə ilə birlikdə canını qurtardı.

### Müxtəlif əhvalatlar

Bu il Div sultan Rumlu Bəlxdən İsgəndər şanlı xaqanın dərgahına gəldi və özbəklərlə döyüş nəticəsində atlarının və adamlarının bədənlərindən çıxarılmış ox ucları ilə dolu olan bir sandıqçanı gətirib o həzrətə təqdim etdi. [Div sultan] bütün toqquşmalarda özbəklərə qalib gəlmişdi. O, Xorasan vilayətinin sahibsiz qaldığını [şaha] ərz etdi. Ona görə də İsgəndər şanlı xaqan Simnan sərhədindən ta Amudərya çayına qədər Xo-

[1805] Bakı nüsxəsi (89a).
[1806] Çəmişkəzək – Türkiyənin Tunceli vilayətinin bir ilçəsi.

rasan səltənətini dinin pənahı və Allahın lütfünün məzhəri olan Əbülmüzəffər Şah Təhmasib həzrətlərinə lütf etdi və Əmir xan Mosullu Türkmanı o həzrətin lələsi [təyin] etdi.

**Ölümlər**

Əlaüddövlə Zülqədərin davranışı hiylə və fırıldaqla dolu idi. Hər dəfə ki Rum sultanlarının elçiləri onun yanına gəlirdilər, o, öz mülazimlərindən bəzilərinə misirlilərin paltarını geyindirir və onları məclisə gətirib deyirdi:

- Bunlar Misir elçiləridirlər ki, Sultan Qansunun yanından mənim hüzuruma gəlmişlər və çoxlu töhfələr gətirmişlər.

O, Rum elçilərinə misirlilərin onu çox narahat etdiyini, lakin özünün Rum sultanına tabe olduğunu və misirlilərdən bezar olduğunu söyləyərdi. Misir sultanından elçilər gəldikdə, onlarla da bu cür rəftar edərdi və hər iki tərəfdən çoxlu qızıl alardı. Daim deyərdi:

- Mənim iki toyuğum var. Bunlardan biri qızıl, digəri isə gümüş yumurtalayır.

O, burada [iki toyuq deyərkən] Rum və Misir sultanlarını nəzərdə tutmuşdur.

Bu il Sultan Səlim istədi ki, İsgəndər şanlı xaqanla daha bir dəfə müharibə etsin və bu düşüncə ilə Əlaüddövlənin sərhədində çoxlu azuqə və sursat topladı. Əlaüddövlə bunları öz malı kimi qarət edib mənimsədi. Lakin o, xəbərsiz idi ki, filin xortumu ilə oynamaq və ilanın alnını tikanla qaşımaq özünü ölümə məhkum etməyə bənzəyir. O, külək kimi fitnə tozunu qaldırdı və öz ruzigarının başına bədbəxtlik torpağını tökdü. Sultan Səlim soyğundan agah olduqda, Azərbaycana yürüşdən vaz keçib Mərəşə doğru yola düşdü. Əlaüddövlə müqavimətə tab gətirmədiyi üçün fərar bayrağını Durna dağına tərəf yüksəltdi. Sultan Səlim Sinan paşanı qırx min süvari ilə onun ardınca yolladı. Rum qoşununun ön dəstəsi sözügedən dağların arasında ona yetişdi. Əlaüddövlə öz oğlu Süleyman bəylə pusqudan çıxıb Rum qoşunlarına həmlə etdi. Çalış-vuruşdan sonra zülqədər qoşunu məğlubiyyətə uğradı və məchul bir adam Əlaüddövləni qətlə yetirib başını Sinan paşanın yanına gətirdi. Sinan paşa onun başını Sultan Səlimin hüzuruna göndərdi.

Şeir

“Lakin axır riyakar çərxi-fələkdən,
Zülqədər şahının[1807] üzü məhaqda[1808] gizləndi.
Giriftar oldu döyüşkən düşmən,
Kəsdilər başını iti qılıncla”.

Xondgar[1809] onun başını kəsən adamdan soruşdu:

- Hansı mənsəbi istəyirsən ki, mən onu sənə verim?

O axmaq adam dedi:

- Öz ağamın mənsəbini.

Halbuki onun ağası orta rütbəli adamlardan idi. Onun ağasını paşa edib [ağasının köhnə] mənsəbini də ona verdilər. Sultan Səlim bütün Zülqədər vilayətini istila etdi. Sonra zülqədərlərin bəziləri Sultan Səlimin mülazimi oldular, bir dəstəsi İsgəndər şanlı xaqanın dərgahına yollandılar, bir qismi isə Sultan Qansunun dərgahına getdilər. Zülqədər sultanlarının dövləti sona çatdı. Tarix kitablarında bu təbəqədən səltənət sürmüş dörd nəfər tapdıq: Məlik Aslan, Süleyman, Nasirəddin və Əlaüddövlə[1810]. Onların məmləkəti Mərəş və Əlbistan idi və səksən min zülqədər ailəsinin rəisi idilər.

Bir müddət Sultan Əbu-Səidin vəziri olmuş Xoca Nemətulla Quhistaninin oğlu Xoca Asəfi şaban [ayının] 16-da (25.09.1515) vəfat etdi. Bir şəxs onun [ölüm] tarixi haqqında demişdir:

Şeir

---

1807 Bakı nüsxəsi: “Zülqədər ayının” (90a).

1808 Məhaq – ayın görünməz olduğu gecə.

1809 Xondgar (Xudavəndigar) – Osmanlı sultanlarının titulu.

1810 Zülqədəroğlu xanədanının burada təqdim edilmiş şəcərəsində natamamlıq var. Daha ətraflı bax: *R.Yınanç. Dulkadir Beyliği. Ankara, 1989.*

"O, bir Asəf[1811] kimi ağıl gözünün bəbəyi idi,
Əcəl buludu arxasında ulduz kimi nihan oldu.
Könül məndən soruşdu ki, [ölüm] tarixi nədir?
Dedim ki, bəratdan gəlmiş ikinci gün"[1812].

Mövlana Nizam Astarabadi bu il dodaqlarına səssizlik möhürü vurdu. "Kitabi-Bilqeys və Süleyman" ("Bilqeys və Süleyman kitabı") və "Divani-qəsaid" ("Qəsidələr divanı") onun əsərlərindəndir.

Mövlana Riyazi Savəci[1813] də bu il dünyadan köçdü. Yaşı səksəni adlamışdı. Əsərlərindən biri nəzmlə yazılmış "Tarixi-Sultan Hüseyn mirzə"dir.

## 922-Cİ İLDƏ (05.02.1516 – 23.01.1517) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Bığlı Çavuşun Qara xan Ustaclu ilə müharibəsinin təsviri

İsgəndər şanlı xaqan Diyarbəkr hakimliyini Qara xana tapşırdığı zaman xan Mardində qərar tutmuşdu, [Diyarbəkrdəki] işlərin yüyənini isə Əhməd Çələbinin iqtidar əlinə vermişdi. Əhməd Çələbi Amidin malcəhətini Qara xana vermədiyi üçün xan ona qarşı qəsd etmək fikrinə düşdü. Əhməd Çələbi [Qara xanın] bu niyyətindən xəbər tutduğuna və vəfasızlıq onun zatına xas olduğuna görə Bığlı Çavuşun yanına bir qasid göndərib ərz etdi: "Münasibdir ki, tam sürətlə özünü bu diyarın hüdudlarına yetirəsən və istədiyini əldə edəsən". Bığlı Çavuş sürətlə məsafələri qət edib şəhər ətrafına çatdı. Əhməd Çələbi onu qarşıladı və qalanın açarlarını ona təslim etdi. Bığlı Çavuş Amiddə yerləşdi. Onun istilasından agah olan Qara xan bir dəstə dilavərlə Amidə yollandı ki, oranın əhalisini yanlış yoldan doğru səmtə yönəltsin. O hüduda çatdıqda, şəhər əhalisi rumilərlə ittifaq edib darvazadan bayıra çıxdılar, ox atmağa, qılınc oynatmağa başladılar və qazilərin qalaya daxil olmasına imkan vermədilər. Xan onların bu hərəkətindən məyus olub o vilayətin ətrafını ələ keçirdi, yolları zəbt etdi və qoymadı ki, şəhərə bir batman yük daxil olsun. Bığlı Çavuş aciz qalıb qaladan beş min süvarini qazilərə qarşı döyüşə göndərdi. Qara xan zəmanə igidlərindən bir dəstəsi və başdan-başa qəzəb və hiddətlə dolu qoşunu ilə birlikdə köhlən atının yüyənini rumilərə doğru çevirib onlara həmlə etdi və onların işini istədiyi kimi həll etdi. Belə ki, onlardan bir nəfər belə sağ qalmadı. Xan bu camaatı qətlə yetirdikdən sonra müzəffər və qalib şəkildə yüyənini öz ordugahına sarı döndərdi. Neçə gündən sonra xəbər gəldi ki, Bığlı Çavuş təxminən iyirmi dörd min süvari və piyada toplayıb Amiddən çıxmışdır. Ona görə də Qara xan öz ordugahından ayrılıb Bığlı Çavuşun düşərgəsinə doğru üz tutdu və Mardin yaxınlığındakı Qoruqda düşərgə saldı[1814]. O zaman [Qara xan] düşündü ki, tezliklə düşmənlə döyüşə girsin və yenidən yer üzünü düşmənlərin qanı ilə gül rənginə boyasın. Qudurmuş sultan da onu [bu işə] həvəsləndirdi və dedi:

- Səfəviyyə xanədanının düşmənlərinə bundan daha artıq möhlət vermək lazım deyildir və onların bədənlərinin divarlarında qılınc və xəncər zərbəsi ilə deşiklər açmaq gərəkdir.

Amma həmin vaxt İsgəndər şanlı xaqanın yanından bir qorçu gəlib onun hökmünü gətirdi ki, bu tərəfdən yardım gəlib çatmayınca döyüşə girməsinlər. Başqa şəxslər də savaşa atılmaqda tələsməyi məsləhət görmürdülər və deyirdilər:

- Kömək gəlib çatıncaya qədər düşmənlə vuruşa başlamaq lazım deyil.

[Lakin] xan Qudurmuşun fikrini daha düzgün hesab etdi. Ertəsi gün o, öz fələk yerişli atına minib bayraqlarını dalğalandırdı, sağ və sol cinahı necə lazımdırsa tərtib etdi. O tərəfdən Bığlı Çavuş sağ və sol cinahları iş bacaran adamlarla möhkəmləndirdi, öz qoşununun qabağında zərbzən və firəngilərlə dolu arabalar

---

[1811] Asəf – dini rəvayətlərə görə, Süleyman peyğəmbərin Asəf ibn Bərxiya adlı çox ağıllı və tədbirli bir vəziri olmuşdur. Sonralar Şərq ədəbiyyatında Asəf adı aqil və səriştəli adamları bildirmək üçün rəmz kimi istifadə olunurdu *(A.M.Babayev. Azərbaycan klassik ədəbiyyatında işlədilən adların və terminlərin şərhi, s.14)*.

[1812] "Ze bərat aməde ruzi-dovvom" = 923 h. Lakin əsərdə onun ölümü 921-ci il hadisələri daxilində qeyd olunmuşdur. Halbuki bəzi digər qaynaqlarda Xoca Asəfinin h. 923-cü ildə vəfat etdiyi bildirilir (bax: *Seddon, şərhlər, s.249*).

[1813] Başqa bir məlumata görə, o, Savədən deyil, Xorasanın Zavə adlı yerindəndir *(Seddon, şərhlər, s.249)*.

[1814] Bu döyüş 1516-cı il mayın ortalarında Qoç-Hisar və Mardin yaxınlığında olan Qoruq adlı yerdə, Dədə-Karğın düzündə baş vermişdir *(Ш.М.Мустафаев. Восточная Анатолия, с.48-49)*. Dədə-Qarğın düzü – Türkiyənin Mardin vilayətinin Qızıltəpə və Derlik ilçələri ilə Şanlıurfa vilayətinin Viranşehir ilçəsi arasında yerləşir *(A.Taşğın. Safevî – Osmanlı savaşından itibaren dinî söylemin siyasal propaganda aracı olarak kullanılması: Dede Kargın örneği // "Türk Kültürü ve Hacı Bektaş Veli Dergisi", sayı: 49, Ankara, 2009, s.210-211)*.

yerləşdirdi, onun ətrafını zəncirlə bir-birinə bağladı və qoşunun arxasında dəvələr və təchizat yerləşdirdi. Məhşər çölünü xatırladan o səhrada hər iki qoşunun səfləri tərtib olunduqdan sonra ilk öncə qazilər qılınclarını sıyırıb və nizələrini düşmənlərə yönəldib rumilərin üzərinə at çapdılar, [onların] sol və sağ cinahlarını yerlərindən dəbərdib mərkəzə doğru sıxışdırdılar. Rumilərin fərar yolu bağlı olduğundan onlar naçar qalıb döyüşə başladılar. Nəql edirlər ki, o gün bir sıra rumilər qazilərin qılıncının zərbəsindən atlarını buraxıb, bir-birinin çiyninə ayaq qoyaraq dolaşırdılar.

Şeir

“Cövhərdar qılıncın (bəlarək) heybətindən kəvər kimi əsdilər,
Döyüşçülər saraldılar zəfəran budağı kimi.
Yer üzü şimşəkdən atəşkədənin içi kimi oldu,
Və lərzədən iflic xəstələrinin üzü kimi oldu zaman”.

Rüstəmə bənzər qazilər iti qılınc zərbəsi ilə cavanların canını deşib onların həyat xırmanını yoxluq (ölüm) küləyinə verdilər. Qılıncın dili canın qulağına “Yer üzündə olan hər şey yox olacaqdır”[1815] ayəsini oxuyurdu və ox səfiri “Hər kəs ölümü dadacaq”[1816] xəbərini yaxına və uzağa yetirirdi. Neçə-neçə cəsəd bir-birinin üstünə qalaqlanmışdı və süvarilərin hərəkətə macalı, piyadaların yeriməyə yeri qalmamışdı.

Şeir

“O qədər ölü var idi ki, döyüş meydanında,
Əcəlin keçməyə macalı qalmamışdı”.

Sancaq əmirləri paşaya dedilər:

- Bizim qoşunumuz alt-üst oldu. İş artıq döyüş alovlarını alışdırmaqdan keçmişdir. Gərək “Məğlub olduğun zaman qaçmaq lazımdır” məzmununa əməl edək və “Qarşısında tab gətirilməyən şeylərdən qaçmaq peyğəmbərlərin ənənəsidir” kəlamının zərurətindən boyun qaçırmayaq.

Bığlı Çavuş bu sözləri qəbul etməyib, öz qoşununu həvəsləndirərək döyüşə təhrik etdi. Bir daha şur və şər dolu rumilər həmlə etdilər. Yenidən qazilər onları dəf edib mərkəzə sıxışdırdılar. Az qalmışdı ki, Bığlı Çavuş köhlən atının yüyənini döyüş meydanından qaçış vadisinə döndərsin. Xan şücaət göstərib rumilərin mərkəzinə at çapdı. Qəzavü-qədər üzündən bir tüfəng açılıb onun həyatının kökünün qırılmasına səbəb oldu. Qazilərin əhval-ruhiyyəsi pozuldu. Rumilər öz yerlərindən hərəkətə gəldilər. Qızılbaşlar fərar etməyə qərar verdilər. Bığlı Çavuş bu xəbəri çatdırmaq üçün Sultan Səlimin yanına bir çapar göndərib Diyarbəkri ələ keçirdi.

## Sultan Səlimin Misir və Şam padşahı Sultan Qansu ilə müharibə etməsinin və Sultan Qansunun məğlubiyyətə uğramasının təsviri[1817]

Bu il Sultan Qansu hərəkət bayrağını Misirdən Hələb tərəfə qaldırdı. O zaman Hələb əmirülümərası Xeyirbəyin Sultan Qansudan qorxusu vardı. Buna görə də o, Sultan Səlimin yanına elçilər göndərdi və ərz etdi: “Əgər zərnigar çətiriniz səadət kölgəsini bu diyarın üzərinə salarsa, mən bəndə xidmət kəmərini dövlət və xoşbəxtlik kimi canımın ortasına bağlayıb Ərəbistan vilayətinin fəthi üçün səy göstərərəm və itaət halqasını huş qulağıma taxıb ömrümün qalan günlərini bayraqlarınızın kölgəsində keçirərəm”.

Sultan Səlim Ərəbistan vilayətini ələ keçirməyi qərara alıb hökm etdi ki, Firəngistanın uzaq yerlərindən ta Qızılbaş diyarına qədər ixtiyarındakı məmləkətlərin qoşunları Amasyada toplansınlar və göstəriş verdi ki, zərbzən və firəngi toplar kimi döyüş və vuruş ləvazimatları hazırlansın. Əsgərlər toplandıqdan sonra o, Hələb tərəfə hərəkətə gəldi. O tərəfdən Sultan Qansu çoxlu ordu ilə savaşa və hərbə yollandı və Davud peyğəmbərin – ona salam olsun – məzarı yanında düşərgə qurdu. Günəş zərrələri kimi çoxsaylı və yağış damlaları kimi bol ordu, hamısı növrəstə cavanlar, başdan-başa bədənlərini və vücudlarını yaraq-yasaqla bəzəyib döyüşə və vuruşa hazır oldular. Sultan Səlim düşmən düşərgəsi yaxınlığında mövqe tutdu.

Şeir

[1815] *Qurani-Kərim, “Rəhman” surəsi, 26-cı ayə.*
[1816] *Qurani-Kərim, “Ənkəbut” surəsi, 47-ci ayə* və *“Ənbiya” surəsi, 36-cı ayə.*
[1817] Bakı nüsxəsi: “Rum padşahı Sultan Səlimin Misir, Şam və Hələb padşahı Sultan Qanisadla müharibə etməsi, Sultan Qanisadın öldürülməsi və onun məmləkətinin Rum padşahı tərəfindən ələ keçirilməsi”.

“Çin ahusu kimi düşüb qaldı yorğunluqdan,
Qarnını qoydu dağın qılıncına (iti yerinə).
Qarnı birdən yarıldı bu qılınc üzündən,
Torpağın göbəyi müşk ilə doldu”.

[Sultan Səlim] qoşunu qorumaq üçün bir dəstəni irəli göndərdi. Misir padşahının qoşunlarından da bir dəstə kəşfiyyat aparmaq üçün qabağa gəldi və gözətçilik etməyə başladılar. Nurani günəş bayrağını qaldırdı və ulduzlar qoşununu məğlub etdi.

Şeir

“Səhər vaxtı ulduzlar dəstəsinin şahı (günəş),
Tərpəndi yerindən təbil və bayraqla.
Üfüqdən ağardı dan yeri şövkətlə,
Köpük saçdı dağın birhürgüclü sərxoş dəvəsi.
Üfüqün istisindən asiman canlandı,
Fələk sübh pambığına büründü.
Belə bir istidən təzə qan axmağa başladı,
Qandan üfüq Nəhrəvan[1818] sahəsinə döndü.
Günəşdən və aydan qızıl təbil əllərində,
Vurdular fələkdən mələklər döyüş təbilini.
Kin ardınca bu ev yandıran qanlı ,
Qanla yudu işıqlı aləmin üzünü”.

Sultan Səlim qoşununu tərtib etməyə başlayıb, Qaramanlı Qaraca paşanı sağ cinaha göndərdi, Sinan paşanı və Zülqədəroğlu Şahsüvarın övladı Əli bəyi sol cinahda yerləşdirdi, səfin önünü zərbzənlərlə və firəngi toplarla dolu olan arabalarla bəzədi. Yeniçərilər bir-birinin ardınca arabaların önündə beş səfdə dayandılar. O tərəfdən Sultan Qansu da ordu səfini tərtib edib, Xeyirbəyi sol cinaha təyin edib, Hümüs və Həma hakimi Canverdi Qəzzalini sağ cinahda yerləşdirdi. Özü isə mərkəzdə qərar tutdu. O iki davakar padşah bu tərtiblə bir-birinin qarşısında dayandılar. Misir qoşunundan yüz nəfərədək igid yaxınlıqdakı təpənin başına çıxdılar ki, Sultan Səlimin ordusunu müşahidə etsinlər. Qaraca paşa zərbzənlər yüklənmiş beş[1819] arabanı onlara qarşı göndərdi. Topçular atəş açıb dörd nəfəri vurdular və qalanları fərar edib öz qoşunlarına qatıldılar.

O əsnada Canverdi Qəzzali bir dəstə ərəb dilavəri ilə qəzəblə rumilərin sağ cinahına basqın etdi. Qaraca paşa müdafiə olunmağa çalışsa da, misirlilərin qoşununun hücumundan onun səbatı və qərarı sarsıldı. Sultan Səlimin sağ cinahı məğlubiyyətə uğradı. Misirlilər Sultan Səlimin mərkəzinin arxasına keçdilər və təqribən beş-altı min nəfəri nizənin ucu ilə atdan saldılar. Yerə düşənlər piyada halda Sultan Səlimin [ordusunun] mərkəzinə çəkilirdilər.

Daha bir dəfə Canverdi Qəzzali sol cinahın arxasından gəldi. Onlar üç min süvarini atdan saldılar və Rum qoşunu fərar edib xondgarın olduğu yerə qədər durmadan qaçdı. Misir qulamları onları təqib edib xondgarın mövqeyinin qarşısına gəldilər. Yeniçərilər Sürəyya (Yeddiqardaş ulduzları) kimi bir yerə cəmləşmiş [misirliləri] tüfəng zərbəsi ilə Binatün-nəş kimi pərən-pərən saldılar. Xülasə, misirli qulamların nizəsi parlaq şimşək kimi rumilərin ifritlərinə doğru dil uzadırdı və rumilərin tüfəngi misirlilərin zirehindən və xəftanından sübh küləyi ipək köynəkdən keçən kimi keçirdi.

Şeir

“O meydanda zərəri dəf etmək üçün,
Tüfəng kin atəşinə üzərlik səpdi.
Qraniti deşən nizələrin ucundan,
Başdan-başa zirehlərdən çeşmələr (qanlar) axdı.
Tüfəngin ağzı sitəmdən açıldı,
Bədəndə yoxluqdan bir qapı açdı”.

---

[1818] Nəhrəvan – İraqın Diyala vilayətində yerləşir. 658-ci ildə burada Həzrət Əlinin qoşunları ilə xaricilər məzhəbindən olan qiyamçılar arasında şiddətli döyüş baş vermiş və nəticədə, Həzrət Əli qalib gəlmişdir.
[1819] Bakı nüsxəsi: “beş-altı”.

Aslan ovlayan pəhləvanların üzü hiddət və kindən şir gözünün rəngini aldı. Meydandakı tozanaqdan canını fəda edən igidlərin ağzının dadı ilan zəhəri (zəhrimar) kimi oldu. Çərkəzlərin[1820] parça-tikə olmuş bədənləri ucbatından gəzmək macalı və keçib-getmək yolu daraldı, yer və səhra təpə və dağ ilə bərabər oldu.

Şeir

"Döyüş meydanında öldürülənlərin yıxılmasından,
Təpə üstündə təpə yarandı Qaf dağı kimi".

Amma Sultan Səlim öz cinahlarının məğlub olduğunu gördükdə yeniçərilərə göstəriş verdi ki, top-tüfəngi işə salsınlar. Qoşun hərəkətə gəlib Sultan Qansuya sarı üz tutdu və onun [ordusunun] mərkəzini top-tüfənglə pərən-pərən saldı. Ürək deşən oxların və atəş açan tüfəng [güllələrinin] gəliş-gedişi əsnasında Xeyirbəy ordunun səfini viran qoyub Sultan Səlimə qoşuldu. Halın bu minvalda olduğunu görən Sultan Qansu döyüşdən əl çəkib qaçış mülkünə üz qoydu. Rumilər onların ardınca düşərək bir çoxlarını qətlə yetirdilər. Hərb meydanında Sultan Qansunun ölüsünü tapdılar və nə qədər yoxlasalar da, onun bədənində bir yara tapa bilmədilər. Rum əsgərlərinin əlinə saysız mallar və bol qənimət keçdi. Sultan Səlim Hələbə getdi. O diyarın əyan-əşrəfi qaladan çıxıb xəzinələrin kilidlərini, darvazaların və dəfinələrin açarlarını Sultan Səlimin vəkillərinin əllərinə təslim etdilər. Təəccüblüdür ki, dəyərli "Həbibüs-siyər" kitabının müəllifi həmin dövrdə yaşamasına baxmayaraq yazmışdır ki, Sultan Qansu təbii əcəllə öldü və Sultan Səlim o diyarı döyüşsüz ələ keçirdi. [Lakin] bu sətirlərin müəllifi Həsən Rumlu o döyüşdə iştirak etmiş on nəfərdən çox igidi görmüş və onlardan bu döyüşün şərhini soruşmuşdur. [Əhvalat] burada yazıldığı kimidir.

### Məhəmməd Zaman mirzənin islamın qübbəsi ("Qübbətülislam") olan Bəlxi ələ keçirməsi haqqında söhbət

Bu il Məhəmməd Zaman mirzə, Əmir Orduşahla ittifaqda Bəlxin kənarına gedib o şəhəri mühasirə etdi[1821]. Div sultan Rumlunun mülazimi olan Məhəmməd Baharlu şəhərin bürcünü və divarını möhkəmləndirdi. Bir neçə aydan sonra Xoca Heydər Əli kələntərlərlə birlikdə Əkkaşə darvazasını[1822] Məhəmməd Zaman mirzənin üzünə açdı. O, şəhərə daxil oldu. Məhəmməd Baharlu iç qalaya (ərk) sığındı. İki gündən sonra o, əhd-peymanla [qaladan] çıxdı və mülazim oldu. Eyni zamanda Əmir Can[1823] Məhəmməd Qasım Şibirğandan bol peşkəşlə Mirzə Məhəmməd Zamanın xidmətinə gəlib onun mülazimi oldu. Əmir Orduşah Bəlxin idarəçiliyini öz qardaşı Qivam bəyə verdi. O səbəbdən Məhəmməd Zaman mirzənin könlünə düşmənçilik tozu qondu və onların ittifaqı nifaqla əvəz oldundu.

### İsgəndər şanlı xaqanın Naxçıvanda qışlaq etməsi və Div sultanın Gürcüstana getməsi haqqında söhbət

Bu il Gürcüstanda Qurqura[1824] və Mənuçöhr arasında müharibə baş verdi. Qurqura fərar edib İsgəndər şanlı xaqanla görüşmək səadətinə nail oldu[1825]. O, Gürcüstan məmləkətinin əhvalını və düşmənlərin [oranı] istila etdiyini bildirdi. [Şahın] günəş kimi parlaq düşüncəsi iltifat şəfəqini Mənuçöhrün əhvalı üzərinə saldı və hökm buyurdu ki, Div sultan Rumlu, Çirkin Həsən Təkəlü, Narın bəy Qacar, Qazaq bəy Rumlu və Həsən bəy Çota tam təcili şəkildə yola çıxıb İlahi kömək sayəsində Gürcüstan ərazisini o mənfurun vücudundan pak etməyə səy göstərsinlər. Əmirlər Şuragel yolundan Aqşəhrə[1826] yönəldilər, asimandan gələn qəza və gözlənilməz bəla kimi o şəhərin ətrafını mühasirəyə aldılar. Bu halı müşahidə edən Mənuçöhrün içinə bir od düşdü, onun qərar ayağı yerindən oynadı və aznavurlarla[1827] Del kəndinə (Qəryeyi-Del)[1828] yönəlib, [oradan]

---

[1820] Məmlüklər nəzərdə tutulur.
[1821] Tehran nəşrində səhvən "o şəhəri qətl etdilər" yazılmışdır.
[1822] Xoca Əkkaşə Bəlxdə basdırılmış bir övliyadır. Bu darvaza onun şərəfinə bu cür adlandırılmış ola bilər. Lakin, bəlkə də, burada Bəlx şəhərinin qərbində əsas darvaza olan Ağca qapı nəzərdə tutulmuşdur *(Seddon, şərhlər, s.250).*
[1823] Baroda nəşri və Məclis nüsxəsi: "Xan".
[1824] Qurqura – 1516-1535-ci illərdə Mesxi (Samtsxe-Saatabaqo) hökmdarı olmuş IV Kvarkvare nəzərdə tutulur. Mesxi hökmdarları xristianlaşmış qıpçaqlardan idilər və "atabəy" titulu daşıyırdılar *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi, s.522).*
[1825] Tehran nəşrində və Bakı nüsxəsində bu görüşün Təbrizdə baş tutduğu yazılsa da, Baroda nəşrində belə bir qeydlə rastlaşmırıq. Əslində, sərlövhədən də göründüyü kimi, bu görüş Naxçıvanda baş tutmuşdu.
[1826] Aqşəhr (Ağ şəhər) – indiki Gürcüstanın cənubundakı Axalkalaki şəhəri *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi, s.453).*
[1827] Aznavur – gürcü döyüşçüsü.
[1828] Məclis nüsxəsi: "Qərsul".

Div sultanın yanına qasidlər göndərərək sülhdən söz açdı. Əmirlər onun elçilərini qətlə yetirdilər və onun üzərinə sürətli yürüş etdilər. Onlar sözügedən kəndin ətrafına çatdıqda, Mənuçöhr fərar edib Ruma getdi. Əmirlər Tümük qalası[1829] ətrafına gəldilər. O qala dərin bir dərənin ortasındakı dağın başında yerləşir. Qazilər qələbə bayraqlarını dalğalandırdılar, zəfər qılınclarını çəkdilər və dairə kimi düzülüb [qalanı] nöqtə kimi dövrəyə aldılar. On dörd gün bədkirdar gürcülərlə əzəmətli qazilər arasında döyüş oldu. Axırda islam qoşunu qalanın su anbarını deşdi və kafirlər acız qalıb Div sultan dərgahına üz tutdular. Mənuçöhrün vəkili olan Erezbar[1830] da layiqli peşkəşlər və müvafiq töhfələrlə qaladan çıxdı. Div sultan Gürcüstanın hakimiyyətini Qurquraya verib geri döndü. Div sultan bu yürüş zamanı Çirkin Həsəni cəzalandırdı (yasaya çatdırdı).

### Müxtəlif əhvalatlar

Bu il İsgəndər şanlı xaqan Təbrizdə qışlaq etdi.

Bu il bahar vaxtı dinin pənahı olan şah (Təhmasib) öz lələsi Əmir xanla birlikdə Herata gəlib şəhər bağında cah-calalla dayandı, həşəmət və bəxtiyarlıq taxtına çıxıb ədalət və rəiyyətpərvərlik qapılarını açdı. O həzrətin uğurlu qədəmləri ilə bu il [o bölgədə] məhsullar son dərəcə bol oldu.

### Ölümlər

Mövlana Abdulla Mərvarid cavanlığında Sultan Hüseyn mirzənin xidmətində olmuş, hətta sədarət mərtəbəsinə çatmışdı. Axırda böyük əmirlər cərgəsinə daxil olmuş, Mir Əlişirin yerinə möhür vurmuşdu. Sultan Hüseyn mirzənin ölümündən sonra tənhalıq küncündə qərar tutmuşdu. Bu il o, dünyadan köçdü. Bu adda əsərləri var: “Divani-qəsaid və qəzəliyyat” (“Qəsidələr və qəzəllər divanı”), “Tarixi-şahi” (“Şahın tarixi”), “Münşəat” (“Məktublar”), “Tarixi-mənzum” (“Mənzum tarix”), “Xosrov və Şirin”.

Sultan Qansu Quri olduqca fazil idi və alimləri sevərdi. Onun qətli ilə Çərkəziyyə sultanlarının dövləti ortadan qalxdı. Bu tayfadan on səkkiz nəfər bu tərtiblə padşahlıq etmişdir: İzzəddin Aybəy, Məlik Mənsur, Sultan Quduz, Bənd Qəddar, Məlik Səid, Məhəmməd Salamış, Məlik Mənsur, Məlik Əşrəf, Məlik Qahir, Məlik Adil, Keyd Buğa, Hüsaməddin Laçın[1831], Sultan Bərquq, Sultan Fərəc, Məlik Çakmak, Sultan Qayıtbay, Nasir Yusifi, Sultan Qansu Quri[1832]. Amma [Sultan Qansu Quridən sonra] Tüməni bəy (Tumanbay) əl-ayaq atsa da, bir iş görə bilmədi. Məmləkətləri Misir, Şam və Hələb idi, Məkkə və Mədinədə də sikkə onların adına vurulardı. Onların dövlətlərinin müddəti iki yüz yetmiş beş il olmuşdur[1833].

## 923-CÜ İLDƏ (24.01.1517 – 12.01.1518) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Sultan Səlimin Misir və Şam tərəfə qoşun çəkməsi, Tüməni bəylə müharibə etməsi, onun üzərində zəfər çalması və o vilayəti ələ keçirməsi

Bu il Sultan Səlim Şama yollandı. Oranın əhalisi şəhəri [ona] təslim etdi və hökmdarın hüsn-rəğbəti onların halına şamil olundu. Cümə günü Bəni-Üməyyə məscidində Sultan Səlim adına xütbə oxudular. O diyarın fəthindən sonra çoxlu dəvələrə su yükləyib Misirə yollandı. O məmləkətin hüduduna çatdıqda eşitdi ki, Misir əmirləri məğlubiyyətdən sonra Sultan Qansunun bacısı oğlu Tüməni bəyi özlərinə padşah ediblər və müxaliflik bayrağını qaldırıblar. Sultan Səlim ordunun tərtibi və yüksək rütbəli paşalarının təchizatının yoxlanması ilə məşğul olub köçhaköçlə Misirə yönəldi və sözügedən şəhərin (Qahirənin) yaxınlığında dayandı.

O tərəfdən Tüməni bəy döyüş və vuruş bayraqlarını qaldırıb, təsəvvür edilə biləndən daha çoxsaylı bir ordu ilə, hamısı başına pəhləvanlıq dəbilqəsi qoymuş və əyninə bahadırlıq zirehi geymiş əsgərlərlə şəhə-

[1829] Tümük (gürcü mənbələrində: Tmoqvi) qalası Axalkalaki şəhərindən qərbdə, Kür çayı sahilində yerləşirdi və bu qalanın ətrafı Tümük ölkəsi adlanırdı.

[1830] Bakı nüsxəsi: “Erezvar”; Baroda nəşri: “Erezbartir” və ya “Arzbanir”; London nüsxəsi: Erezbatır; Məclis nüsxəsi: “Erbanir”.

[1831] Bakı nüsxəsində bu arada “Sultan Nasir” yazılmışdır.

[1832] Bakı nüsxəsində son iki şəxs bir adam kimi təqdim olunub: “Sultan Qanisayi-Nasir Yusifi Quri”.

[1833] Məmlüklər h. 648-923 / m. 1250-1517-ci illərdə hakimiyyət sürmüşlər. Daha ətraflı bax: *К.Э.Босворт. Мусульманские династии: справочник по хронологии и генеологии (перевод с английского и примечания П.А.Грязневича). Москва, 1971.*

rin xaricində döyüş səfi bağladı, qoşunun qarşısına çoxlu zərbzən və firəngi qoydu. Misirin mötəbər əmirlərindən olan Ramazanoğlu[1834] ərz etdi:

- Dövlət üçün faydalı olan budur ki, şəhərin darvazasını bağlayıb döyüşə başlayaq.

Tüməni bəy onun sözünü qəbul etməyib Sultan Səlimin qarşısında səf çəkdi. Bu əsnada Misir qoşunundan bir qulam fərar edib, Sultan Səlimin yanına gedərək ona bunları ərz etdi:

- Misirlilər sizin qoşununuzun qarşısında çoxlu top və firəngi qoymuşlar ki, [onlardan] sizin qoşununuza atəş açsınlar.

Sultan Səlim düşmənlərinin arxasına keçib onları top-tüfəngə tutdu. Misirlilər hələ öz top və firəngilərini meymunək[1835] üzərinə qoymadıqları üçün onları döndərməyə aciz oldular və fərar etdilər. Sultan Səlim onların toplarını və zərbzənlərini ələ keçirib Misirin (Qahirənin) qarşısına gəldi. Kələntərlər və əyanlar üzrxahlıq etmək və əfv diləmək üçün qaladan çıxdılar və niyaz üzlərini padşahın dərgahının torpağına sürtüb aman istədilər. Sultan Səlim onların təqsirlərinin üstündən keçib Sinan paşanı bir dəstə dilavərlə şəhərin içinə göndərdi ki, o şəhəri mühafizə etsinlər.

Sinan paşa şəhərə daxil olduqdan sonra gecə yarısı Məmlüklər və ərəb camaatı, şəhərin orta və aşağı dərəcəli adamları onun üstünə tökülüşdülər. Sinan paşa müdafiə olunmağa başladı. Lakin axırda misirlilər qalib gəldilər və Sinan paşanı səkkiz yüz qulamla birlikdə qətlə yetirdilər. Digər əmirlər mərdliklə döyüşüb onun cəsədini şəhərdən çıxardılar. Sultan Səlim özü şəxsən şəhərin içinə getdi və şəhər meydanında dayandı. Yeniçərilər tüfənglərini doldurub döyüşə və vuruşa hazır oldular. Sultan Səlim şəhər əyanlarını tutub onlardan bir çoxlarını qətlə yetirdi. Misirlilər ərz etdilər:

- Biz bundan öncə törətdiyimiz əməllərdən peşmanıq. Ümid edirik ki, padşah bizim günahımızdan keçəcək. Bundan belə xidmətkarlıq və fədakarlıq yolunu tutacağıq.

Sultan Səlim bəzilərinə fəxri xələt bağışlayıb onları şad və xoşhal etdi. Misir qulamları (Məmlüklər) rəiyyətin köməyindən ümidlərini üzdükdən sonra gecə vaxtı şəhərdən çıxıb Həbəşistana[1836] və Zəngibara yollandılar. Sultan Səlim qorxusuz-hürküsüz Misirdə qışlaq etdi. Baharda Tüməni bəy Həbəşistandan beş min həbəş qulamla döyüş əzmi ilə Misirə gəldi. Sultan Səlim bu xəbəri eşidib Qaraca paşanı çoxsaylı dəstə ilə onların yolunu kəsməyə göndərdi. O iki qoşun qarşı-qarşıya gəldilər və səfləri tərtib etməklə məşğul oldular. Hər iki tərəfdən ad-san arzusunda olanlar meydana cumdular. Qan saçan qılıncla yer üzünü Bədəxşanləlinin rənginə boyadılar. Yenə də qulamlar (Məmlüklər) məğlubiyyətə uğradılar. Tüməni bəy əsir alınıb qəhr şihnəsinin əlindən şəhidlik şərbətini içdi. Tamam Misir, Şam, Hələb və Hicaz Sultan Səlimin hakimiyyəti altına keçdi. O, Misir əyalətini Xeyirbəyə verdi. Şam hakimliyini isə o zaman misirlilərdən üz çevirib Sultan Səlimin xidmətinə gəlmiş Canverdi Qəzzaliyə lütf etdi. [Sonra] bol qürurla və qeyri-məhdud mallarla İslambola (İstanbula) yönəldi.

### Əmirlərin Qərcistana getməsi və Mirzə Məhəmməd Zamanın məğlubiyyəti haqqında söhbət[1837]

Bu il Mirzə Məhəmməd Zaman, Əmir Orduşahı qətlə yetirdi. [Sonuncu] adı çəkilən şəxsin qardaşı Qivam bəy Bəlxin bürcünü və divarını zəbt edib bir-birinin ardınca Kabilə elçilər göndərdi və Babur padşahdan yardım istədi. Buna görə də o həzrət Bəlxə yollandı. Qivam bəy qalanı və şəhəri mülazimlərinə tapşırıb hökmdar ordusuna qoşuldu. Babur padşah bir dəstə igidlə Mirzə Məhəmməd Zamanın üzərinə sürətli yürüş edib onun ailəsini və köçünü ələ keçirdi. Mirzə Məhəmməd Zaman bol kədərlə Qərcistana tərəf yola düşdü. O vilayətin hakimi Əmir Şah Məhəmməd Seyfəlmülük və Xoca Qiyasəddin Əli onu qarşılayıb tabeçilik örtüyünü çiyinlərinə saldılar. İki gündən sonra Baburun qələbə ayətli bayraqları Ağgünbəd mövqeyinə öz kölgəsini saldı. Amma qərcistanlıların hamısı Mirzə Məhəmməd Zamanı dəstəklədiklərindən, Babur padşah dağlıq əraziyə daxil ola bilməyib Firuzkuh və Qur yolundan Kabilə yollandı. Məhəmməd Zaman mirzənin Qərcis-

[1834] Bu şəxsin Adana və Çukurova bölgəsində bəylik quran və o zamana qədər əsasən Məmlüklərdən asılı olan Ramazanoğulları sülaləsindən olması ehtimalı yüksəkdir.

[1835] Topları döndərmək və hədəfə daha yaxşı tuşlamaq üçün istifadə olunan mexanizm.

[1836] Həbəşistan – Afrikada ölkə. Efiopiya nəzərdə tutulur.

[1837] Məclis nüsxəsi: “Mirzə Məhəmməd Zamanla Babur padşahın bir-biri ilə çəkişməsi, Şah Təhmasibin Məhəmməd Zamanın üzərinə Heratdan Qərcistana qoşun göndərməsi və onun qaçması”.

tan vilayətinə gəlməsi dinin pənahı olan şahın (Təhmasibin) qulağına çatdıqda İbrahim sultan Mosullunu və Əhməd sultan Əfşarı izdihamlı qoşunla ali mənşəli şahzadənin üzərinə göndərdi. Qazilər Qərcistanda qiyamçılara yetişdilər. Mirzə Məhəmməd Zaman və Seyfəlmülük özlərini istehkamlı (qorunaqlı) dərələrə çatdırmağı münasib bildilər. Amma qançı moğol[1838] camaatının bir qismi dilə gəlib dedi ki, "biz bu torpaqlarda öldürülməyi üstün tuturuq" və döyüşə hazır oldular. Rüstəm səviyyəli qazilər və Təhmasib şahın mülazimləri mücadiləyə başladılar. İki tərəfin müharibəsindən, hərb və dava atəşinin alovlanmasından sonra şah həzrətlərinin qoşunu o yanlış yolun yolçularına qalib gəldi. Mirzə Məhəmməd Zaman San və Çaryekə yollandı. Əmirlər sağ-salamat və qənimətlərlə Herata döndülər. Babur padşah tərəfindən Bəlx hakimi olan Əmin bəy, İbrahim Calıqla birlikdə onun üstünə getdi. Məhəmməd Zaman mirzə yüz nəfər mülazimi ilə birlikdə mücadiləyə başladı. Rəqibləri onu atdan aşırdılar. Moğol camaatından bir nəfər onun əlinə qılınc vurub onu qətlə yetirmək istədi. Məhəmməd Zaman mirzə öz adını dedi. O şəxs onu öz atına mindirib Əmin bəyin yanına gətirdi və o da onu Kabilə yolladı. Babur padşah onunla əhd-peyman bağladıqdan sonra Bəlx əyalətini ona lütf etdi və öz qızını ona nikahladı. Üç aydan sonra onu məiyyət və qoşunla Bəlxə göndərdi. [Məhəmməd Zaman mirzə] məqsədinə çatdığı üçün nəfsani hisslərinin tələbi və əclaflar zümrəsinin təhriki ilə əksər günlərini qırmızı şərab (şərabi-ərğəvani) içməklə keçirərdi və məmləkət məsələlərinin həllindən uzaq durardı.

### Müxtəlif əhvalatlar[1839]

Bu il İsgəndər şanlı xaqan Naxçıvanda qışlaq etdi.

Həmçinin bu il Mənuçöhr Gürcü, Sultan Səlimin əmirlərindən olan Qızıl Əhməd oğlu[1840] ilə birlikdə Rumdan Gürcüstana gəldi ki, ölkəni Gürcüstan valisi Qurquradan alıb ona versin. Gürcüstan valisi Qurqura Qaraca-Ərdəhanda[1841] onlarla döyüşüb qalib gəldi və Qızıl Əhməd oğlu bir sıra rumilərlə birgə qətlə yetirildi. Çuxursəəd hakimi[1842] Div sultan Davelini[1843] qarət edib Çuxursəədə geri qayıtdı.

## 924-CÜ İLDƏ (13.01.1518 – 02.01.1519) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın Durmuş xanı Mazandaran hakimi Ağa Məhəmməd Ruzəfzunun üzərinə göndərməsinin və oranın işlərinin həll edilməsinin təsviri

Bu il İsgəndər şanlı xaqan eşitdi ki, Mazandaran valisi Ağa Məhəmməd Ruzəfzun başını itaət kəməndindən və boynunu tabeçilik boyunduruğundan çıxarmış, üzünü uzlaşma səmtindən nifaq yoluna döndərmişdir. Ona görə də itaəti vacib olan fərman verildi ki, Durmuş xan Şamlu bir dəstə igidlə Mazandarana yollansın.

Durmuş xan [asimandakı] bürclərin ulduzlarından daha çox və yəcucların sayından daha artıq bir ordu ilə Mazandarana yönəldi. Ağa Məhəmməd yağış damlaları qədər əsgərlərin gəlişindən agah olduqda Övlad və Kəlis qalalarını möhkəmləndirdi. Qazilər zilhiccə [ayının] 15-də (18.12.1518) Kəlis qalasını əhatə etdilər. Üç gündən sonra aləmi yandıran qoşunlar zorla və güclə qalanı tutdular. O zaman şücaətli xan məiyyət və ordu ilə Övlad qalasına yollandı. Xanın əmri ilə Qazı Cahan qalanın içinə gedib, əhd-peyman edərək Ağa Məhəmmədi oradan çıxardı. Xan cənabları Tanrının yardımı ilə Sariyə yönəldi. O diyarın valisi Əmir Əbdülkərim qorxduğu üçün öz oğlu Seyid Sultan Məhəmmədi on iki min[1844] Təbriz tüməni ilə birlikdə xanın yanına göndərdi. Eyni zamanda Seyid Hüseyn Həzarcəribi və Rüstəmdar hakimləri Məlik Kavus və Məlik Bəhmən bol peşkəşlə xanın ordusuna gəldilər və hüsn-rəğbət qazanıb öz vətənlərinə geri döndülər.

---

[1838] Ç.N.Seddon hesab edir ki, "qançı" moğol tayfalarından birinin adıdır *(Seddon, şərhlər, s.252).*

[1839] Məclis nüsxəsi: "Səlimin Mənuçöhr Gürcü ilə kömək göndərməsi və rumilərin Qurqura Gürcü xanın əlində ölməsi".

[1840] Burada haqqında bəhs edilən şəxs XIV-XV əsrlərdə Kastamonu və ətrafında hökm sürən, daha sonra isə Osmanlıların xidmətinə keçən Candaroğulları (İsfəndiyaroğulları) ailəsindən Qızıl Əhməd bəyin oğlu Mirzə bəydir. O, həmin zaman Osmanlıların Bayburt bəylərbəyisi idi *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi, s.115-118).*

[1841] Ərdəhan (Ardahan) – Türkiyənin şimal-şərqində, Gürcüstanla sərhəd yaxınlığında vilayət mərkəzi.

[1842] Baroda nəşrində "Çuxursəəd hakimi" əvəzinə "o çevrədə olan" yazılmışdır.

[1843] Daveli (Dav-eli) – hal-hazırda Türkiyənin Ərzurum vilayətinin Şenkaya, Olur, Oltu, Narman, Tortum ilçələrini və Artvin vilayətinin Yusufeli ilçəsini əhatə edən və o zamanlar xristianlaşmış qıpçaq atabəylərinin ölkəsinin (Samtsxe-Saatabaqo) bir hissəsini təşkil edən tarixi mahal.

[1844] Ç.N.Seddona (vol. II, p.82) görə: "iki min".

### Müxtəlif əhvalatlar

Bu il İsgəndər şanlı xaqan Təbrizdə qışlaq etdi.

Bu il içində Şirvan padşahı Şeyxşah, Rəşt padşahı Əmirə Dibac və Lahican valisi Karkiya Sultan Əhməd astananı öpmək izzəti ilə şərəfləndilər. Əmirə Dibac "Müzəffər sultan" ləqəbi aldı.

Bu il içində Gürcüstan hakimi Məlik Qurqura aləmin pənahı olan dərgaha gəldi. İsgəndər şanlı xaqan Div sultanı onunla birlikdə Gürcüstana göndərdi. Div sultan Lori və Zulem[1845] qalalarını ələ keçirdi.

### Ölümlər

Əzəmətin və rütbənin ən yüksək dərəcəsinə qalxmış xasseyi-şərifə sərkarının təbibi Mövlana Əlaəddin Əhməd pnevmaniya xəstəliyindən bu il dünyadan köçdü.

## 925-Cİ İLDƏ (1519) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Aləmin pənahı olan şahın Qərcistan tərəfə qoşun göndərməsi

Bu il aləmin pənahı olan şah, zəfər sahibi (əbülmüzəffər) Şah Təhmasib öz lələsi Əmir xan Mosullunun qardaşı İbrahim sultanı Qərcistan vilayətinə basqın etməyə göndərdi. Oranın valisi Əmir Şah Məhəmməd sayı ulduzlar qədər olan ordunun gəlişindən agah olduqda Kəştinur qalasına sığındı və Əmir Cəfər Əlini elçi kimi İbrahim sultanın yanına göndərib xahiş etdi ki, sözügedən vilayəti ona versinlər. İbrahim sultan onu (elçini) qətlə yetirdi. Üç gündən sonra aləmi yandıran ordu yürüş etdi. İgidlik və cəsurluq meşəsinin aslanı Sevəroğlu[1846] bürcün başına çıxdı. Şah Məhəmməd Seyfəlmülük bir dəstə miskin adamla qalanı tərk edib Meymənə tərəfə qaçdı. İbrahim sultan qalanı viran edib Herata yönəldi.

## 926-CI İLDƏ (23.12.1519 – 11.12.1520) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Babur padşahın Qəndəhar tərəfə hərəkət edib Zünnun bəyin oğlu Şüca bəyin üzərinə getməsi

Bu il Babur padşah hərəkət bayrağını Qəndəhara doğru qaldırdı. Şüca bəy qalaya sığınıb öz qoşununa döyüş atəşini alovlandırmağı əmr etdi. Babur padşahın mülazimləri qalib gəldilər və onları darvazaya kimi qovdular.

Şüca bəy Herata, Əmir xanın yanına iş bacaran qasidlər göndərib ona yalvar-yaxar etdi. Əmir xan, Babur padşahın yanına elçilər göndərib [bunları] bildirdi: "Hərçənd Şüca bəy bundan öncə başını itaət kəməndindən və ayağını tabeçilik yolundan kənara çıxarmışdırsa da, amma indi peşmançılıq qədəmi ilə irəli gəlib bundan belə şah dərgahının bəndələrindən olacağını qəbul etdiyi üçün münasib odur ki, o həzrət (Babur) mühasirəni tərk edib Kabilə yollansın". Babur padşah cavab verdi ki, "Qəndəharı tutduqdan sonra Şüca bəyi dinin pənahı olan şahın dərgahına göndərəcəyəm və Qəndəhar mülkünü istədiyiniz şəxsə təslim edəcəyəm". O, Qəndəharı fəth etmək üçün tam səy göstərdi və təqribən üç il bu minvalla mühasirə davam etdi. Qəndəharda mühasirədə qalanların əhvalı çətinləşdi. Şəhərin biçarələri və pərişanlıq zindanının məhbusları əziyyətə, dərdə, möhnətə və bəlaya giriftar oldular. Növbəti il Durmuş xan Herat hakimi olduqdan sonra öz mülazimi Müzəffər bəyi Babur padşahın yanına göndərdi və xahiş etdi ki, o, Qəndəhardan köç edib öz vilayətinə yollansın. Şüca bəy Qəndəharı öz mülazimi Mövlana Baqiyə tapşırıb Xorasana yola düşdü. Mövlana isə Şüca bəyin ona etdiyi yaxşılıqları unutqanlıq tağı üzərinə qoyub, Babur padşahın yanına qasid göndərərək onu [Qəndəhara] çağırdı. Babur padşah geri dönüb Qəndəharı ələ keçirdi və o diyarın idarəçiliyini öz oğlu Kamran mirzəyə həvalə etdi.

Həmçinin bu il İsgəndər şanlı xaqan İsfahanda qışlaq etdi.

---

[1845] Baroda nəşri və Bakı nüsxəsi: "Kuri və Surem".

[1846] Məclis və Nuruosmaniyyə nüsxələri: "Samur"; Bakı nüsxəsi: "Teymuroğlu".

**Ölümlər**

Sultan Səlim ibn Sultan Bayəzid ibn Sultan Məhəmməd ibn Sultan Murad ibn Sultan Məhəmməd ibn İldırım Bayəzid ibn Sultan Murad ibn Orxan ibn Sultan Osman ibn Ərtoğrul taun xəstəliyindən vəfat etdi[1847]. Zalım padşah idi. Səltənətinin müddəti səkkiz il, səkkiz ay və səkkiz gün olmuşdur. Məmləkəti Anadolu, Urum-eli, Təkkə-eli, Mərəş, Kəfə, Şam, Hələb, Misir və Diyarbəkr idi. Dörd döyüş etmişdir: birinci döyüşü atası Sultan Bayəzidlə, ikincisi öz qardaşı Sultan Əhmədlə, üçüncüsü həzrət Şah İsmayılla və dördüncüsü Misir və Şam padşahı Sultan Qansu ilə. Oğlu Sultan Süleyman Amasyada idi[1848]. Onu tam məxfi şəkildə İstanbula gətirib taxtda oturtdular. Şair Əmini hər misrasından onun cülusunun tarixi peyda olan bir qəsidəni nəzm sapına düzmüşdür və bu beyt oradandır:

Şeir

“Zəmanə vermişdir səadət mülkünü[1849],
Əsrin Kavusuna və zamanın Süleymanına”[1850].

## 927-Cİ İLDƏ (12.12.1520 – 30.11.1521) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Xorasan vilayətində baş vermi hadisələrin və Übeyd xan Özbəyin Herata gəlişinin təsviri[1851]

Bu il Übeyd xan otuz min süvari ilə Amudərya çayından keçib Herata yönəldi. Pəncşənbə günü, sözügedən ilin cəmadiülaxır [ayının] 16-da (24.05.1521)[1852] Sərəxs vilayətinin hakimi Sevindik bəy Herata adam göndərib bu hadisəni xəbər verdi. Qazilər qalanı möhkəmləndirməklə məşğul oldular. Piri sultan Rumlu ilə Sufiyan xəlifə Rumlu İraq darvazasını nəzarətə götürdülər. Məlik darvazasını Əmir Yusifin oğlu Əmir Məhəmməd mühafizə etdi. Əmir xanın oğlu Mərcimək sultan Xoş darvazasını qorudu. Əmir xanın qardaşı Noxud bəy Firuzabad darvazasını mühafizə etməyə səy göstərdi. Əmir xan cavanlardan beş yüz nəfərlə şəhər bağında qərar tutdu. Şənbə gününün səhərində, sözügedən ayın 18-də (26.05.1521)[1853] Əmir xanın fərmanına əsasən Çehel-doxtəran (“Qırx qız”) qəsəbəsində[1854] olan Şatır Abdulla şəhərə gəlib Übeydulla xanın yaxınlaşması xəbərini ərz etdi. Onun bu işarəsi ilə cənab xan şəhərin içindən çıxıb Zağan bağı ətrafında yerləşdi. Yekşənbə gününün səhər çağı Übeyd xan çoxlu özbəklə Do-bəradəran (“İki qardaş”) yolundan xiyabanın üzərinə gəlib Saqi-Salman[1855] ətrafında dayandı. İki gündən sonra o, xırman yandıran özbəklərlə birlikdə ata minib özbəklərə savaş atəşini alovlandırmağı əmr etdi və onların bir dəstəsi Zağan bağı tərəfə gəldi. Bəziləri xiyabana daxil olub sultan mədrəsələri (mədarisi-sultani) yaxınlığına çatdılar. Əmir Qiyasəddin Məhəmmədin nökəri Əmir Hüseynəli divə və vəhşi heyvana bənzəyən bəzi adamlarla şəhərdən çıxdı. İki mədrəsə arasında böyük bir döyüş baş verdi. Übeyd xanın adamlarını ox və tüfəng zərbələri ilə geri oturtdular. Həmçinin növbəti dəfə Übeydin özbəkləri İraq darvazası tərəfdən hücuma keçdilər və qazilərin əlindən təsirli yaralar alıb öz ordugahlarına geri döndülər. Cümə günü, rəcəb [ayının] 2-də (08.06.1521) [Übeyd xan] köç edib özünün div xasiyyətli ordusu ilə Salar körpüsünə getdi və oradan köçhaköçlə Buxaraya yollandılar. Herat əhli mühasirədən xilas oldu.

### Rum vilayətində baş vermiş hadisələr

Sultan Səlimin vəfatı xəbəri Şam vilayətinə çatdıqda, Canverdi Qəzzali müxaliflik etməyə başlayıb bir sıra çərkəz və ərəb əmirləri ilə Hələb ətrafında məskən tutdu. Sultan Səlim tərəfindən o qalanın hakimi

[1847] Başqa bir məlumata görə, I Sultan Səlim şirpəncə deyilən bir çiban üzündən vəfat etmişdir *(İ.H.Uzunçarşılı. Osmanlı tarihi, II. c., s.289).*
[1848] Əslində Sultan Süleyman həmin zaman Manisa valisi idi.
[1849] “Bedade zəman mülkəti-kamrani” = 926 h.
[1850] Baroda nəşri: “ikinci Süleymana”.
[1851] Məclis nüsxəsi: “Übeyd xanın Herata gəlməsi və döyüşməsi”.
[1852] 24 may cümə gününə, 23 may isə pəncşənbə (cümə axşamı) gününə təsadüf etmişdir.
[1853] Şənbə günü 25 maya təsadüf etmişdir. Tehran və Baroda nəşrlərində səhvən “ayın 13-də” yazılmışdır. Bakı nüsxəsində: “seşənbə günü, sözügedən ayın 13-də”.
[1854] Çehel-doxtəran qəsəbəsi – Heratın şimalında, Badğis bölgəsində yerləşir. Əndican yaxınlığında da eyni adlı yer vardır *(Seddon, şərhlər, s.254).*
[1855] Saqi-Salman (Saq-Salman) – Heratın şəhərətrafı bir bölgəsidir.

olan Qaraca paşa şəhərə sığındı. Şam qoşunu müharibəyə və mühasirəyə başladı. Rumilər müdafiə olundular və vuruşdular. Bir aya yaxın o yolunu azmış güruh şəhər ətrafında oturdu və gözlərini samanlı palçıq kimi divara tuşladılar. Hər gün döyüşkən cavanlar və tünd xasiyyətli bahadırlar hiddətlə şəhərdən çıxıb onlara həmlə edirdilər. Gecə vaxtı göy üzü qaraldığı zaman [Qəzzalinin adamları] köç kosunu döyəcləyərək Dəməşqə yollandılar.

Şeir

"Bir gecə ki, mağaradan daha qaranlıq idi,
Bir gecə ki, yardan uzaq qaldığın gün qədər qara idi.
Cahan zəncinin üzündən daha qara idi,
O, aşiq üçün qarışqanın gözü kimi dar idi".

Qaraca paşa vəziyyətin nə yerdə olduğunu ali taxtın ətəyinə ərz etdi. Sultan Süleyman, Fərhad paşanı döyüşkən və qızğın bir ordu və saysız top-tüfənglə onu (Qəzzalini) dəf etməyə və aradan qaldırmağa göndərdi. Paşa sürətli yürüşlə məsafələri qət edib Şahsüvar Zülqədərin oğlu Əli bəylə birlikdə Dəməşq ətrafında dayandı. Canverdi Qəzzali də qantökən qoşunlarla birgə döyüş və vuruş niyyəti ilə [onları] qarşılamağa çıxdı. Dava-qırğından sonra fəth və zəfər yeli Fərhad paşanın bayrağının pərçiminə əsdi. Canverdi Qəzzali o döyüşdə qətlə yetirildi. Fərhad paşa müzəffər və qalib şəkildə İstanbula qayıdıb Sultan Süleymanın yanında Şahsüvar Zülqədərin oğlu Əli bəydən şikayət etdi. Ona görə də Sultan Süleyman, Fərhad paşanı Zülqədər diyarına göndərdi. O, həmin diyara çatıb məkr və hiylə ilə özünü xəstəliyə vurdu. Əli bəy istədi ki, ona baş çəksin. Oğlu Vələd bəy dedi:

- Bizim dövlətimiz üçün sərfəli olan odur ki, Fərhad paşanı qətlə yetirib onun ordusunu qarət edək və İsgəndər şanlı xaqanın dərgahına yollanaq. Çünki onun xəstəliyi hiylədir.

Əli bəy oğlunun sözü ilə razılaşmayıb Fərhad paşanı görməyə getdi. Onlar onu qətlə yetirdilər[1856].

### Div sultanın Gürcüstana qoşun çəkməsi[1857]

Bu il Gürcüstan hakimi Ləvənd xan[1858] başını itaət kəməndindən və boynunu tabeçilik boyunduruğundan çıxardı və cəmi imansız kafirləri Şəki vilayətinə basqın etməyə göndərdi. O diyarda bəla tozu qalxdı. O diyarın hakimi Həsən bəy ərizə yazıb, ali taxtın ətəyinə göndərərək yardım istədi. İsgəndər şanlı xaqan Div sultan Rumlunu bir sıra böyük əmirlər və adlı-sanlı bahadırlarla ona köməyə göndərdi. Div sultan Qanıq və Qabırrı[1859] [çaylarından] keçib Zəkəm və Girema[1860] basqın etdi və Qori[1861] kəndində yerləşdi. Ləvənd bildi ki, qızğın filə qarşı durmaq və qəzəbli aslanla pəncələşmək ağılsızlıqdır. O, dikbaşlığı və sərdarlığı itaətkarlıq və xidmətkarlıqla əvəz etməkdən başqa bir tədbir tökə bilmədi. Onun könlü bu düzgün fikirdə qərar tutduqdan sonra bu uğurlu xəbərin şəfəqi onun daxilini aydınlatdı, araya vasitəçiləri saldı, acizlik əli ilə şəfaət ətəyindən yapışdı, acızlik və yalvarış dili ilə keçmişdə olanlara görə üzr istəyib ərz etdi: "Mürüvvət çöhrəsi düşmənçilik vasitəsi ilə cırıldığından bu günlərdə [sizinlə] görüşmək [mənə] çətindir və [özümü] xidmətinizə yetirə bilmədiyim üçün üzr istəyirəm. Əgər cənabınız geri dönərsə, bir müddət sonra bəndəniz aləmin pənahı olan şahın dərgahına tələsərəm, xidmətkarlıq mərasimini və itaətkarlıq şərtlərini yerinə yetirərəm". Ona görə də Div sultan oradan geri dönüb ulu dərgaha yönəldi.

### Müxtəlif əhvalatlar

Bu il içində İsgəndər şanlı xaqan Naxçıvanda qışlaq etdi.

---

[1856] Bakı nüsxəsi: "Paşa onu tutub qətlə yetirdi".
[1857] Məclis nüsxəsi: "Ləvənd Gürcünün müxalifliyi, onun Şəki məmləkətinə basqın etməsi və İsgəndər şanlı xaqanın Div sultanı bəzi əmirlərlə birlikdə Ləvəndin ölkəsi üzərinə basqına göndərməsi haqqında".
[1858] Ləvənd xan Gürcü – 1518-1574-cü illərdə Kaxet çarı olmuş Levan nəzərdə tutulur.
[1859] Tehran nəşrində yanlışlıqla "Fateq və Qiri" yazılmışdır.
[1860] Zəgəm – Azərbaycanın indiki Zaqatala rayonunda tarixi bir qala olmuşdur. Bu qala Şəki hakimlərinin ərazisi olsa da, gürcü çarları tərəfindən zəbt edilərək bir müddət Kaxetə tabe edilmişdi *(Ə.Quliyev, göst. əsər, s.37).* Girem (gürcücə "Qremi") – Gürcüstanın şərqində, Kaxet vilayətində, Alazan çayının sol sahilində, Telavi və Kvareli şəhərləri arasında mövcud olmuş tarixi şəhər.
[1861] Tehran nəşrində "Qiri" yazılmışdır.

Bu il Ağa Məhəmməd Ruzəfzun, saxlandığı şah ordusundan fərar edib Mazandarana getdi. Əmir Əbdülkərim onunla döyüşüb onu məğlub etdi. Ağa Məhəmməd fərar edib Övlad qalasına sığındı. İsgəndər şanlı xaqan, Çuxa sultan Təkəlünü İraq və Kürdüstan qoşunu[1862] ilə onun üzərinə göndərdi. Çuxa sultan bir həftəyə Övlad qalasını tutub, Ağa Məhəmmədi ələ keçirərək dərgaha göndərdi. Mazandaran əyaləti Əmir Əbdülkərimə verildi. O, qəbul etdi ki, dövlət xəzinəsinə (xəzaneyi-amirə) yeddi min tümən ödəsin.

Həmçinin bu il Şirvan padşahı Şeyxşah İsgəndər şanlı xaqanın dərgahına gəldi.

Yenə bu il Rum padşahı Belqrad qalasını fəth etdi və Firəng kafirlərini o diyardan qovdu.

**Ölümlər**

Xoca Mövlana İsfahani[1863] sünnilik məzhəbində son dərəcə təəssübkeş idi və İsgəndər şanlı xaqanın dövlətinin zühuru zamanı Herata getmişdi. Şeybək xan Xorasanı istila edəndən sonra Mövlana, xana xidmət etməyə qərar verdi. Əhli-Beytə[1864] ədavət etdiyi üçün Məhəmməd xan daim ona tənə vurardı. O, sözügedən ilin cəmadiyüləvvəl [ayının] 5-də (13.04.1521) Buxarada keçindi. “Tarixi-aləmara” onun əsərlərindəndir[1865].

Mövlana Abdulla Hatifi, Mövlana Caminin bacısı oğlu idi. Sözügedən ilin məhərrəm [ayında] (12.12.1520 – 10.01.1521) axirət aləminə köçdü. Mənzum əsərləri sırasında bunlar vardır: “Xosrov və Şirin”, “Leyli və Məcnun”, “Həft mənzər” (“Yeddi surət”), “Teymurnamə”, “Şahnameyi-Həzrət Şah İsmayıl” (“Şah İsmayıl həzrətlərinin şahnaməsi”)[1866].

Əmir Yusifin oğlu Əmir Məhəmməd, Əmir xan Mosullu Türkman tərəfindən şənbə günü, rəcəb [ayının] 8-də (13.06.1521)[1867] şəhid edildi. Bu xəbəri alan İsgəndər şanlı xaqan belə bir şübhəyə qapıldı ki, Əmir xan yanlış yolun yolçusu olub müxaliflik meydanında cövlan edir. O, Durmuş xanı Xorasan əyalətinə göndərdi. Əmir Yusifin oğlu Əmir Məhəmmədi qətlə yetirdiyi üçün Əmir xanın ürəyini xof bürüdü. O, şənbə günü, zilqədə ayının 19-da (21.10.1521)[1868] dinin pənahı olan şahın (şahzadə Təhmasib mirzənin) üzəngisi həndəvərində Səbzəvar vilayətinə doğru hərəkət etdi və söz yaydı ki, “Əmir Məhəmməd, Babur padşahı Xorasana gətirib Heratı ona vermək istəyirdi. Mən onun bu niyyətindən xəbər tutduqdan sonra cəza qılıncı ilə onun canını aldım. İndi isə gedirəm ki, Babur padşahı ortadan qaldırım”.

O zaman Durmuş xan və Zeynal xan Malan körpüsündə dayanmışdılar. Durmuş xan, Əmir xanın gedişindən agah olub onun yanına getdi. Əmir xan ona ziyafət verdi. Fərəh doğuran camın əllərdə dolaşması sayəsində dövranın qəmi o sərvərlərin başından getdi. Durmuş xanın dostluq piyaləsi üzündən Əmir xanın inadkarlıq möhnəti ülfətlə əvəz olundu. Adı çəkilən şəxs (Əmir xan) özü üçün yəqinləşdirdi ki, əvvəlki qaydada Herat əyaləti məhz ona məxsus olacaqdır. O, yüyənini pis düşüncə və baş qaldırmaq çölünə hərəkətdən geri çəkib Herata yola düşdü.

O əsnada Xoca Həbibulla ali məqamlı xaqanın dərgahından gəlib, dinin pənahı olan şahın (Təhmasibin) ordusunun yaxınlığında yerləşdi və Durmuş xanın yanına adam göndərib [bunları bildirdi]:

- Məndə Əmir Yusifin oğlu Əmir Məhəmmədin qətli ilə bağlı Əmir xanın vəzirlərini və yaxınlarını sorğuya çəkmək barəsində bir neçə fərman (pərvanəçə) vardır. Əgər xan cənabları məsləhət bilsələr, Əmir xanla görüşüb bu hökmləri ona izhar edərəm.

---

[1862] İraqi-Əcəmdə və İranın Kürdüstan vilayətində dislokasiya edilmiş qızılbaş qoşunları nəzərdə tutulur.

[1863] Ağqoyunlu Sultan Yaqubun saray tarixçisi, “Tarixi-aləmarayi-Əmini”nin və bəzi digər əsərlərin müəllifi olan Fəzlulla ibn Ruzbehan Xunci nəzərdə tutulur (bax: *Фазлуллах ибн Рузбихан Хунджи. Тарих-и алам-ара-йи амини. Баку, 1987, с.16-37*).

[1864] Əhli-Beyt (ərəbcə “ev əhli” deməkdir) – Məhəmməd peyğəmbərin qızı Fatimə xanım və kürəkəni, həm də əmisi oğlu Həzrət Əli vasitəsilə davam etmiş sülaləsi (peyğəmbər nəsli).

[1865] Məclis nüsxəsində bu müəllif haqqında Təbrizin din xadimlərindən və Məşrutə inqilabının aparıcı simalarından olan, h. 1330-cu ilin Aşura günündə (31 dekabr 1911-ci ildə) rus əsgərləri tərəfindən edam edilən Musa oğlu Siqqətülislam Hacı Mirzə Əli ağa tərəfindən belə bir haşiyə qeydi yazılmışdır: “Burada nəzərdə tutulan şəxs Xoca Fəzlulla ibn Ruzbehan ibn Fəzlulla əl-İsfahanidir. Məlumdur ki, o, Əllamə Hillinin “Kəşfül-həqq” (“Haqqın kəşfi”) kitabına qarşı “İbtalül-batil” (“Batilin ləğvi”) kitabını yazmış və Qazı Nurulla Şüştəri də “İhqaqül-həqq” (“Haqqın bərpası”) kitabını sözügedən kitaba (“İbtalül-batil”ə) qarşı qələmə almışdır. Bu mətləbin dəlili odur ki, “Kəşfüz-zünun” müəllifi həmin bu “Aləmara” kitabının Xoca Molla kimi tanınan Fəzlulla ibn Ruzbehan tərəfindən yazıldığını bəyan etmişdir”.

[1866] Şah İsmayılın tarixi haqqında yazdığı mənzum əsər yarımçıq qalmışdır və üç nüsxəsi məlumdur (bax: *Ч.А.Стори. Персидская литература, ч. II, с.852*).

[1867] 13 iyun cümə gününə təsadüf etmişdir. Şənbə günü 14 iyundur.

[1868] 21 oktyabr bazar ertəsi (düşənbə) gününə təsadüf edir.

Cavabında xan [xəbər] göndərdi:

- Mən razı deyiləm ki, Əmir xan məndən zərər görsün. Həmin hökmləri gizlət!

Ertəsi gün Xoca Həbibulla köç əsnasında Əmir xanla görüşdü. Əmir xan etiraz əlaməti olaraq ondan soruşdu:

- Mən Xoca Şahhüseynə qarşı nə pislik etmişəm ki, mənə zərər vermək istəyir?

Cavabında xoca dedi:

- Siz Rəsulun (Məhəmməd peyğəmbərin) – ona və nəslinə Allahın salamı olsun – övladlarından (nəslindən) olan Əmir Yusifin oğlu Əmir Məhəmmədi əsassız şəkildə qətlə yetirdiniz. Mirzə Şahhüseyn o ailəni sevənlərdəndir.

Əmir xan xocadan bu sözü eşidən kimi üzünü çevirdi və xoca Herata yönəldi.

## 928-Cİ İLDƏ (01.12.1521 – 19.11.1522) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Aləmin pənahı olan şahın (Təhmasibin) İsgəndər şanlı xaqanın hüzuruna gəlməsi

Bu il dinin pənahı olan şah (Təhmasib) İsgəndər şanlı xaqanın dərgahına yollandı. Əmir xan o həzrətin üzəngisi həndəvərində yola çıxdı. Yekşənbə günü dördüncü iqlimin hakimi ulduzlardan daha çoxsaylı qoşunla Azərbaycan tərəfə hərəkətə gəldi. Mərhələləri və köç mənzillərini qət etmək əsnasında Əmir Məhəmməd ibn Yusifin qanını nahaq yerə tökməsi ucbatından Əmir xanda oynaq xəstəliyi (mərəzi-məfasil) baş qaldırdı. Belə ki, ata minməyə qüvvəsi qalmadı. Ona görə də qürur atından enib kəcavədə oturdu.

Dinin pənahı olan şah (Təhmasib) ali məqamlı xaqanın ordusuna çatdı. Böyük əmirlər və dövlət ərkanı o həzrəti qarşıladılar, ona peşkəş təqdim etdilər, alqış və dua söylədilər. İsgəndər şanlı xaqan əziz və möhtərəm oğlunun – dinin pənahı olan şahın mübarək camalını görməkdən şad oldu.

### Müxtəlif əhvalatlar

Bu il İsgəndər şanlı xaqan Təbrizdə qışlaq etdi.

Bu il Durmuş xan Heratda viran olmuş hər kəndi və nahiyəni əkinə yararlı hala saldı. İsgəndər şanlı xaqanın göstərişi ilə Astarabad əyaləti Zeynal xan Şamluya həvalə edildi. Zeynəddin sultanı İsfərayin hakimi təyin etdi. Əhməd sultan Əfşarı isə Fərah vilayətində və onun ətrafında hakim etdi.

### Ölümlər

Əmir xan ibn Gülabi bəy ibn Əmir bəy Mosullu. Həsən padşahın səltənəti zamanında Əmir bəy olduqca mötəbər idi və Sultan Əbu-Səidin əmirləri ilə görkəmli döyüşlər etmişdi. [Onun nəvəsi olan Əmir xan] bu il yekşənbə gecəsi, şaban ayının 12-də (07.07.1522)[1869] canını Əzrailə tapşırdı.

## 929-CU İLDƏ (20.11.1522 – 09.11.1523) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Rum padşahı Sultan Süleymanın Rodosu tutması

Rodos kafirləri dəfələrlə Rum padşahı Sultan Süleymana qarşı düşmənçilik göstərdikləri üçün bu il o, suyu (dənizi) keçərək Rodosa yönəldi. O qalanın hakimi Meqal Meturi[1870] rumilərin gəlişindən agah olan kimi Firəngistana adam göndərərək yardım istədi. Firəng dilavərləri böyük bir qoşunla qorxusuz-hürküsüz Rodosa gəldilər. Sultan Süleyman böyük bir ordu ilə qalanın ətrafında yerləşdi. Okean kimi ucsuz-bucaqsız olan çoxsaylı qoşunun təlatümündən "İki dənizi bir-birinə O qovuşdurdu" ayəsi[1871] müşahidə olundu. Rum padşahı qoşuna qalanın ələ keçirilməsi üçün əmr verdi. Rum qoşunu buyruğa əsasən iqtidar əlini səy qolçağından çıxardı və qalanı zəbt etməyə üz qoyub, toplar və badliclər quraşdıraraq qalanın daşatanlarını (mancanaqlarını) xarab etdi. Məmaliki-məhrusədən (Osmanlı dövlətinin vilayətlərindən) əlində bel və külüng tut-

---

[1869] 7 iyul bazar ertəsi (düşənbə) gününə təsadüf edir.

[1870] Bakı nüsxəsi: "Meqal Feturi". Əslində həmin zaman Rodos adası xristian cəngavərlərin İohannitlər ordeninin əlində idi və onlara "Grand Maitre" ("böyük ustad") tituluna malik Villers de l`il Adam başçılıq edirdi *(Seddon, şərhlər, s.255).*

[1871] *Qurani-Kərim, "Rəhman" surəsi, 19-cu ayə.*

muş təqribən üç yüz min piyada gətirilməsi hökm olundu və qalaya doğru lağım atıldı. Firənglər iztiraba düşüb Sultan Süleymanın yanına yaxşı nitq qabiliyyətinə malik elçilər göndərdilər və sülhdən söz saldılar. Əhdpeyman bağlandıqdan sonra onlar qalanı təslim edib, öz mallarını gəmiyə qoyaraq Firəngistana yönəldilər. Sultan Süleyman o diyarı ələ keçirib İslambola gəldi. Şair Mövlana Niyazi ilk misrasından [Sultan Süleymanın] cülusunun (hakimiyyətə gəlişinin) tarixi və ikinci misrasından İrodos (Rodos) fəthinin tarixi çıxan bir qəsidəni nəzm sapına düzmüşdür və bu beyt oradandır:

Şeir

“Əvvəlcə taxta çıxmaqla başı uca oldu,
İkincisi isə İrodosun fəthi ilə, ey Niyazi”.

Eyni zamanda, Rodos adasının fəthi üçün digər bir tarix “Yəfrəhul-muminun binəsrillah” (“O gün möminlər sevinəcəklər Allahın köməyi ilə”)[1872] ifadəsidir ki, bu da 929 edir.

**Ölümlər**

Ümidi Tehrani səlis şeir təbinin qüvvəsinə görə dövran şairlərinin öndəgedəni idi. Onunla Şah Qivaməddin Nurbəxş arasında bir bağ üstündə ədavət vardı. Bu il bir gecə vaxtı o, Bayandur Övladı bir dəstə ilə birlikdə Mövlana Ümidinin üzərinə göndərdi. Onlar ona bir neçə yara vurdular və Allahın rəhmətinə qovuşdu. [Şah Qivaməddin] intiqam alan Cabbarın (Allahın) qəzəbindən və Əhmədi-Muxtarın (Məhəmməd peyğəmbərin) hiddətindən çəkinmədi.

Şairlərdən biri onun [ölümü] haqqında bir tarix (maddeyi-tarix)[1873] demişdir:

Şeir

“Əsrin nadiri olan məzlum Ümidi,
Haqsız yerə şəhid edildi qəflətən.
Gecə mənim yuxuma gəldi və dedi ki,
Ey mənim iç halımdan agah olan!
Mənim qətlimin tarixi haqqında yaz ki,
Ah mənim nahaq qanımdan, ah!”[1874]

Mirzə Şahhüseyn gənclik dövründə İsfahanda memarlıq və bənnalıq peşəsi ilə məşğul idi. Ondan sonra kiçik dövlət vəzifələrində çalışdı, xüsusən də Durmuş xanın mülazimi olan İsfahan daruğasının vəziri oldu. Daha sonra İsgəndər şanlı xaqana göstərdiyi hər cür layiqli xidmətlər sayəsində xaqanın hüsn-rəğbəti və sultanın mərhəməti ilə əhatə olunub yüksək dərəcəli və böyük şanlı vəkalət vəzifəsi ilə şərəfləndirildi. Həqiqətən də, bu müqəddəs rəvağın memarı və bu dəbdəbəli tağın mühəndisi (Allah) bu zümrüd əsaslı göyün və bu zəbərcəd[1875] kərpicli yerin binasını yaratdıqdan bəri vəzarət divanında onun kimi bir məqam sahibi əyləşməmişdi. Yüksək iradəsi o dərəcəyə çatmışdı ki, bir gündə hər kəsə mükafat və bəxşiş kimi min tümən bağışlamışdı. Qürurunun çoxluğundan, hökmdarın lütfkarlığına güvənərək heç kimi saymırdı. Qüdrətli dövlət ərkanını belə vecinə almırdı. Buna görə də hamı ondan bezib onun ömrünün və həyatının əsasının məhv edilməsi üçün müttəfiq oldular.

O cümlədən rikabxana təhvildarı[1876] Mehtər Şahqulu Rikabdar [dövlətə] bir qədər borclu idi. O vəzarət sahibi (Mirzə Şahhüseyn) ondan [borcunu ödəməyi] tələb etdi. Bu, onun hörmətini azaldan bir hal idi və adı çəkilən mehtər [qisas almağa] fürsət tapdı. Belə ki, çaharşənbə günü, sözügedən ilin cəmadiyüləvvəl [ayının] 28-də (14.04.1523)[1877] [Mirzə Şahhüseyn] dövlətxanadan çıxıb öz mənzilinə gedən zaman Mehtər Şah-

[1872] *Qurani-Kərim, “Rum” surəsi, 4 və 5-ci ayələr.*

[1873] Maddeyi-tarix – klassik Şərq şeirində müəyyən hadisələrin, əsərlərin tarixini, görkəmli şəxslərin təvəllüd və ölüm illərini göstərmək üçün istifadə olunan ifadə tərzi. Maddeyi-tarixlər bəzən rəqəmlərin açıq-aşkar sadalanması ilə, bəzən isə əbcəd hesabı ilə verilirdi *(Ə.M.Mirəhmədov. Ədəbiyyatşünaslıq: ensiklopedik lüğət. Bakı, 1998, s.121).*

[1874] “Ah əz xuni-nahəqqi-mən ah” = 925 h. Lakin mətndə bu hadisə h. 929-cu ilin hadisələri daxilində verilir. Ümimiyyətlə, Mövlana Ümidinin ölüm tarixi dəqiq deyildir. Onun 1519-1524-cü illər arasında öldüyü güman edilir *(E.G.Browne. A History of Persian Literature in The Modern Times /A.D. 1500-1924/. Cambridge, 1924, p.230-233).*

[1875] Zəbərcəd – sarıya çalan yaşıl rəngli və şüşə kimi parlaq qiymətli daş (zümrüd cinsindən olsa da, zümrüd qədər qiymətli deyildir).

[1876] Şahın at tövləsinin rəisi.

[1877] Çərşənbə günü 15 aprelə təsadüf etmişdir.

qulu gizlicə onun arxasından gəlib, xəncərini belindən sıyıraraq onun çiyninə [zərbə] vurdu, daha sonra orada hazır olan qorçulara dedi ki, şahın əmrinə görə, biz bu şəxsi parça-parça etməliyik. Onlar da qılınclarını çəkib onu qətlə yetirdilər. Bu üzücü hadisədən əmmaməsi ənbər qoxan qələm qana qərq olub torpağa düşdü və kağızın müşk ətirli, qara geyimli mürəkkəbi dayanmadan axan göz yaşlarının təsirindən təmiz üzlü gözəllərin rüxsarı kimi xətt naxışlarından pak oldu.

Şeir

“Dəvat qüssədən tüstü ilə yoldaş oldu,
Ağzı açıq qaldı fəğan üçün.
Onu o qədər təəccüb bürüdü ki,
Qələmin barmağı onun ağzında qaldı.
Onun içi də bayırı kimi quru oldu,
Qələmin dili bu dərddən tutuldu”.

Mehtər Şahqulu, Mirzə Şahhüseyni qətlə yetirib, ay kimi hərəkət edən bir ata minərək Şirvana yönəldi. Şirvan padşahı Şeyxşah onu tutub aləmin pənahı olan dərgaha göndərdi. İsgəndər şanlı xaqan onu Mirzə Şahhüseynin qulamlarına verdi ki, onlar onu qətlə yetirsinlər.

Nadir təsadüflərdəndir ki, Mirzə Şahhüseynin qətlindən dörd gün öncə Qazı İsanın qardaşı oğlu Qazı Əbdürrəhman Savəci röya aləmində müşahidə etdi ki, Mirzə Şahhüseyn asimana yüksəlib birdən yerə düşdü və varlıq paltarını yoxluq küləyinə verdi. O əsnada bir kəs ona dedi ki, Mirzə Şahhüseyn İsfahaninin həyatının müddəti sona çatdı, onun adı və nəsəbi [əbcəd hesabı ilə] ölümünün tarixi oldu.

Qazı yuxudan oyandıqdan sonra “Mirzə Şahhüseyn İsfahani” ifadəsini [əbcəd hesabı ilə] hesabladı və o sözlərin ədədlə qarşılığı ona yuxuda deyilənlərə müvafiq olduğu üçün heyrəti daha da artdı. O, Əmir Cəmaləddin Sədrin yanına tələsib, başına gələn hadisəni ərz etdi.

Qəflətən həmin hadisə baş verdi. Mirzə Şahhüseynə mərsiyə olaraq Xoca Ziyaəddin Mirəm demişdir:

Şeir

“Onun nurlu düşüncəsi lütf səmasının günəşi idi,
O, fələyin aynası idi, cahanı göstərən bir güzgü idi.
Səxavət dəryası Şahhüseynin şərəfi o qədərdi ki,
Onun bənzərini görməmişdir əyyamın gözü.
Fələk onun himmət qəsrinin astanasıdır,
Bu qəsr sidrədən daha ucadır.
Dağa demişlər sanki onun hökmü ilə,
Qucağından axıtsın həya suları.
Onun səadətli taleyinin günəşi zavala uğradıqda,
Qara bəxt onun kölgəsi kimi düşdü arxadan.
O, fələyin ayaq zərbəsi ilə əldən getdi,
Bax ki, hadisənin əlindən ayaqdan düşdü (yıxıldı).
Zaman gülşənində gül kimi qana qərq oldu,
Onun ömür köynəyi lalə kimi [qırmızı] oldu.
O, cənnət bağı olan Kərbəlada sakin oldu,
Yerin-göyün müqəddəs rövzəsində.
Onun ölümünün tarixini Ziyai ağıldan soruşdu,
Mənim can qulağıma qeybdən gəldi bu nida.
Bir səhifə üzərinə nurdan yazmış tale qələmi,
Bir xətt ki, qəza anında ondan qan damlamış.
Məzmunu odur ki, civarında məqam tapdığı üçün,
Tarixi oldu “Kərbəla şəhidlərinin şahı”[1878].

[1878] “Şahi-şəhidani-Kərbəla” = 929 h.

Onun ölümündən sonra Xoca Cəlaləddin Məhəmməd Xandəmir Təbrizi onun yerinə keçdi.

## 930-CU İLDƏ (10.11.1523 – 28.10.1524) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### İsgəndər şanlı xaqanın çöl atı (cüyür) ovlamaq üçün Şəki tərəfə getməsinin təsviri

Qış fəsli sona çatdıqda, sevgili gül bülbülün könlünü ovlamaq üçün çöhrəsini göstərdi və zümrüd rəngli taxtda oturdu.

Şeir

"Ən uğurlu bir saatda şah cənabları,
Qoç bürcünün (baharın) gəlişindən kam aldı.
Açdı güllər təntənə və şövkətlə,
Lalə ilə doldu çölün və dağın ətəyi.
Laləgülü gözəllərin dodağı kimi meypərəst,
İşrət vaxtı gülgün qədəhlər əlində".

Şikar havası və bahara[1879] tamaşa etməyin həvəsi savaş cıdırı şahsüvarının (Şah İsmayılın) başında peyda oldu. O, Təbrizdən köç edib Şəki tərəfə hərəkət etdi. Ali göstəriş verildi ki, qazilər və əyanlar dayandıqları yerdən çöl atlarını (cüyürləri) qovub o bölgənin mövqelərindən birində toplasınlar. Onlar şahın əmrini icra etdilər. Elə ki cərgə tərtib olundu, cüyürləri tutdular. O əsnada Şəki valisi Həsən bəy bol peşkəşlə asiman nişanlı dərgaha gəldi və [şahın] kimya kimi təsirli nəzəri qarşısına çıxdı. O həzrət (Şah İsmayıl) ovdan qayıdıb ata-babasını ziyarət etdikdən sonra Səraba yönəldi və Sayın-gədiyində dayandı. Həmin məqamda o həzrətin səhhəti pozuldu.

### Müxtəlif əhvalatlar

Həmçinin bu il Ləvənd bəy Gürcü Şəkiyə qoşun çəkdi. O diyarın hakimi Həsən bəy yaxşı silahlanmış bir qoşun dəstəsi ilə birlikdə döyüşə gəldi. İki tərəf arasında olduqca gərgin bir müharibə baş verdi. Şəki qoşunu məğlubiyyətə uğradı və Həsən bəy həmin döyüşdə şəhid oldu. Ləvənd bəy Girəmə geri döndü. Şəki camaatı [Həsən bəyin] oğlu Dərviş Məhəmməd xanı hakim etdi.

Həmçinin bu il əmirülüməra Çayan sultan Ustaclu vəfat etdi. Onun yerini oğlu Bayəzid sultana verdilər. Bir neçə gündən sonra o da öldü. Div sultan əmirülümərа oldu.

### Ölümlər

Şah İsmayıl ibn Sultan Heydər ibn Sultan Cüneyd ibn Şeyx İbrahim ibn Sultan Xoca Əli ibn Sultan Sədrəddin ibn Sultan Şeyx Səfiəddin. Bu il onun zatının cövhərini xəstəlik bürüdü. Məsih nəfəsli həkimlər və məharətli təbiblər hərçənd müalicə etsələr də, fayda vermədi və saatbasaat onun qüvvəsi zəiflədi, təbiəti (vücudu) buna müqavimət göstərməkdən aciz oldu.

Şeir

"Bu dəqiqədə bütün həkimlər çarəsiz qaldılar,
Allahın hökmü qarşısında adam nə edə bilər ki?!
Nəbz üsulu öz əsl hərəkətindən sapdığı zaman,
Acizlik çalasına düşdü Əflatunun ayağı.
Onun vücudunun sağlamlığı pozulmağa üz qoydu,
Bihudə qaldı Əbu-Əlinin əlində "Qanun"[1880].

Xülasə, düşənbə gecəsi, rəcəb ayının 19-da (23.05.1524) iqbal səmasının günəşi cah-calal bürcündən yoxluq məğribinə qürub etdi və səltənət asimanının nuru izzət və kamal zirvəsindən zaval sərhədinə köçdü.

Şeir

"Qopardı könlünü bu köhnə dünyanın işlərindən,

---

[1879] Məclis və Nuruosmaniyyə nüsxələri: "dağlara".
[1880] Məşhur alim Əbu-Əli ibn Sinanın təbabət haqqında yazdığı "Qanun" kitabı nəzərdə tutulur.

Uçdu qəfəsdən onun ruhunun quşu göylərə.
Aləmin möhnətindən uzaq oldu,
Könlü başqa bir mülkü arzu eylədi".

Əmir Cəmaləddin Məhəmməd Sədr Astarabadi seşənbə gecəsi, rəcəbin 20-də (24.05.1524) o həzrətin misilsiz bədəninə qüsl verdi və daha sonra onun cəsədini Ərdəbilə aparıb öz uca məqamlı ata-babasının yanında dəfn etdilər.

Şeir

"Aləmin viranəsindən incik idi,
Nihan oldu torpaqda xəzinə kimi".

O həzrət rəiyyət və tabeliyindəkilərlə ədalət və şəfqət yolu ilə davranırdı və onun qorxusundan heç kəs zülm və zorakılıq qapılarını xalqın üzünə açmırdı.

Şeir

"Nə qılınc işlətdi ədəb üzündən,
Özünün yalın bədənini qoydu ortaya.
Nə hakimlərlə meyil və qəsd birliyi etmədi,
Nə qazılarla rüşvətxorluq ayıbına bulaşmadı.
Onun təvazökarlığı sayəsində o zaman,
Yox idi cazibə kəhrəbanın bədənində.
Əgər bir kəs gecə bir təqsir işləsəydi,
Sübh olunca onun müjdəsi cəza olardı.
Tərəzi kimi edildi daşqalaq,
Hər kim ki qızıla meyilli idi".

Ömrünün müddəti otuz səkkiz il, səltənət zamanı iyirmi dörd il olmuşdur. Məmləkəti Azərbaycan, *İraqi-Ərəb,* İraqi-Əcəm, Xorasan, *Fars, Kirman və Xuzistan*[1881] idi. Bəzi vaxtlarda Diyarbəkr, Bəlx və Mərv də onun hakimiyyəti altında olmuşdur.

O həzrət döyüş meydanında xəncər vuran cəngavər (hərfən: "yırtıcı aslan"), əyləncə məclisində isə gövhər yağdıran bulud idi. Son dərəcə səxavətli olduğu üçün tam əyarlı qızıl və dəyərsiz daş onun gözündə eyni şey idi. O qədər alicənab idi ki, dənizin və mədənin hasilatı onun bir günlük bəxşişinə kifayət etməzdi. Əksər vaxtlarda xəzinəsi boş olardı. Ova çıxmağı çox sevərdi və təkbaşına aslan öldürərdi. Əmr etmişdi ki, vəkillər aslan xəbəri gətirənə yəhərli at, pələng xəbəri gətirənə isə yəhərsiz at versinlər və təkbaşına gedib aslanı və pələngi qətlə yetirərdi.

O həzrət səltənəti əyyamında beş döyüş etmişdi: birinci döyüş Şirvan padşahı Fərrux Yəsarla Cəbani mövqeyində; ikinci döyüş *türkman padşahı* Əlvənd bəylə Şərurda; üçüncü döyüş Sultan Murad Türkmanla Həmədanın Almaqulağında[1882]; dördüncü döyüş Şeybək xanla[1883] Mərv ətrafında; beşinci döyüş *Rum padşahı* Sultan Səlimlə Çaldıranda.

O həzrətin dörd oğlu vardı: birincisi – kama çatmış əlahəzrət Şah Təhmasib[1884]; ikincisi – Sam mirzə; üçüncüsü – haqtanımaz Əlqas mirzədir ki, zəlalət qasidinin bələdçiliyi ilə cürət addımını müxaliflik vadisinə qoymuşdu; dördüncüsü – Əbülfəth Bəhram mirzə.

O həzrətin beş qızı vardı: birincisi – Xanış xanım; ikincisi – xilafət sədəfinin incisi və "vilayət" səmasının ulduzu Pərixan xanım; üçüncüsü – möhtərəm fələk sahiblərinin günəşi Məhinbanu Sultanım; dördüncüsü – Firəngiz; beşincisi – Zeynəb xanım[1885]. O həzrətin tifillik vaxtında vəfat etmiş oğullarının və qızlarının bu əhatəli kitabda sadalanmasının faydası yoxdur. Ona görə də bu sətirlərin müəllifi bu işə baş qoşmadı. O həzrətin [vəfatının] tarixi haqqında demişlər:

Şeir

[1881] Bakı nüsxəsi (105a).
[1882] Bakı nüsxəsi: "Almabulağı".
[1883] Bakı nüsxəsi: "Şahibəy xan Özbəklə".
[1884] Məclis nüsxəsi: "Uca məqamlı Şah Təhmasib – Allah onun hakimiyyətini əbədi etsin!"
[1885] Bakı nüsxəsi: "Şahzeynəb xanım".

“Dünyanın pənahı olan Şah İsmayıl,
Elə ki günəş kimi örtüyə bürünüb cahandan getdi,
“Zill” (“kölgə”) sözü onun [vəfat] tarixi oldu,
Kölgə günəşin tarixi oldu”.

Başqa birisi də o hadisə haqqında demişdir:

Rübai

“Bir şah ki, günəş kimi cahanı işıqlandırdı,
Təmizlədi zülm tozunu yer üzündən.
O aslan ovlayan şahın vəfat tarixini,
Din xosrovundan istə ki, oldu dinin xosrovu (“xosrovi-din”)”[1886].

Qasım xan ibn Seyyidək xan ibn Canibəy xan ibn Büraq ibn Qaraca ibn Quzi xan[1887] ibn Urus xan ibn Çatmay xan ibn İrzən ibn Sası Buğa ibn Quyi[1888] ibn Aurd[1889] ibn Cuci ibn Çingiz xan bu il dünyadan köçdü. Şücaətli padşah idi. Məmləkəti Dəşti-Qıpçaq və qazax qəbilələri idi. Ondan sonra oğlu Haqnəzər xan xanlığın başına keçdi və hələ də Dəşt hökmranlığı ona məxsusdur.

Fərrux Yəsarın oğlu Şeyxşah bu il kədər məkanından (bu dünyadan) sevinc məkanına (axirətə) köçdü. Səltənətinin müddəti iyirmi üç il olmuşdur. Məmləkəti Şirvan idi. Ondan sonra yerinə oğlu Sultan Xəlil keçdi.

Mirzə Şahhüseyndən sonra vəzir olmuş Xoca Cəlaləddin Xandəmir Təbrizi vəzir olduğu gün bu rübaini oxudu:

Rübai

“Ey cahanın gözünün nuru, de, necə dözüm?!
Sən getdin, gecə kimi qara oldu gündüzüm.
Sanki biz bir-birinə bağlı iki şam idik,
Əyyam səni öldürdü, mən də yanıram özüm”.

Nə qədər ki həyat libası o həzrətin (Şah İsmayılın) xilafət qamətini bəzəyirdi, adı çəkilən xoca o həzrətin müstəqil vəziri idi. İsgəndər şanlı xaqanın vəfatından sonra o, dinin pənahı olan şahın vəziri oldu. Onunla əmirülümərа olan Div sultan Rumlu arasında küdurət ortaya çıxdı. Axırda iş oraya gəlib çıxdı ki, adı çəkilən əmirin zülm atəşinin alovları onun həyatının əsasını yandırdı və vücudunun külünü yoxluq küləyi sovurdu. Məşhurdur ki, onu həsirə bürüyüb yandırdıqları gün öz halına münasib olan bu beyti oxumuşdur:

Şeir

“Bəla məhəlləsində ev tutdum, atəş bürüdü məni,
Kim ki bəla məhəlləsində ev tutsa, belə olacaq”.

## Dinin pənahı olan Şah Təhmasibin səltənət taxtına əyləşməsi[1890]

Piçin-yılda (meymun ilində), rəcəb ayının 19-da (23.05.1524), düşənbə gününün çaşt vaxtında İsgəndər şanlı xaqan Əbül-Müzəffər Şah İsmayıl Bahadır xanın xələfi, dinin pənahı və Allahın kölgəsi olan həzrət (Şah Təhmasib) səltənət kürsüsünə əyləşdi. Həmin vaxt onun mübarək yaşı on il, altı ay və iyirmi gün[1891] idi.

Şeir

“Ey aləm şahı Təhmasib, Allahın köməyi ilə,
Qazi şahdan sonra qızıl taxta çıxdın.
Atanın yerini tutdun, cahanı ələ keçirdin,
Səltənət tarixin belə oldu: atanın yerini tutdun”[1892].

[1886] “Zill” və “xosrovi-din” ifadələrinin əbcəd hesabı ilə qarşılığı 930-dur.
[1887] Bakı nüsxəsi: “Tuzi xan”; Baroda nəşri: “Qazi Aq”.
[1888] Baroda nəşri və Bakı nüsxəsi: “Quli”.
[1889] Bakı nüsxəsi: “Aurda”.
[1890] Məclis nüsxəsi: “Şah Təhmasib Hüseyni Səfəvinin – dünya durduqca bərqərar olsun – səltənətə əyləşməsi haqqında”.
[1891] Məclis nüsxəsi: “iyirmi üç gün”.
[1892] “Cayi-pedər gerefti” = 930 h.

Ali mənşəli əmirlər və yüksək dərəcəli vəzirlər xidmət kəmərini bellərinə bağlayaraq öz yerlərində durdular.

Şeir

“Şətrənc şahlarıtək dayanmışdılar,
Ordu şahzadələri şah qarşısında.
Güllər çəmənin sinəsində bitdikləri kimi,
Müdrik başçılar həmin məclisdə oturmuşdular”.

Digər böyüklər və kiçiklər asiman kimi (uca) bargahın ətrafında qərar tutub gözlərini və qulaqlarını o həzrətin işarəsinə zillədilər. Dinin və dövlətin nizam-intizamı, mülkün və millətin vəziyyəti tamamilə rövnəq tapdı. Beləliklə, yeni bir padşahlar padşahı zahir oldu.

Dinin pənahı olan şah əyanları və əmirləri padşahanə bəxşişlər və xosrovanə ərməğanlarla mükafatlandırıb hamısının xatirini xoş tutdu. O, məmləkət işlərinin yüyənini Div sultan Rumluya təqdim etdi, Cəlaləddin Məhəmmədin yandırılmasından sonra ali divanın nəzarətini Qazı Cahan Qəzviniyə tapşırdı və Əmir Qivaməddin Hüseyn İsfahanini sədarət vəzifəsində Əmir Cəmaləddin Məhəmməd Astarabadiyə şərik etdi. [Şah] həmin qış mövsümündə Təbrizdə qışlaq etdi və Xorasanın idarəçiliyini əvvəlki qaydada Durmuş xana həvalə etdi.

Übeyd xan ibn Mahmud sultan, Şeybək xanın qardaşı oğlu idi. O, Mahmud xanın ölümünün ardından Buxarada hakim olmuşdu. Şeybək xanın qətlindən sonra [Übeyd xan] Xorasanı işğal etmək iddiasında olsa da, İsgəndər şanlı xaqanın qaniçən qılıncının qorxusundan kamına çata bilməyərək öz tamahını boğmalı olmuşdu və Buxara məmləkəti ilə qane olub öz yerində oturmuşdu. Bu il o, Çingiziyyə xanları və fitnəkar özbəklərlə birlikdə Amudərya çayından keçib Xorasana hərəkət etdi. Bu xəbər Herata çatdıqda Teymuroğlu[1893], Hüseyn mirzə, Xoca Həbibulla və sair dövlətsevər qazilər ali məqamlı [Durmuş] xanın məclisinə gedib məşvərət büsatına əyləşdilər və qəti qərarlar qəbul etdilər. Firuzabad darvazasının qorunması Xoca Həbibullaya tapşırıldı. İraq darvazası Teymuroğluya təhkim olundu. [Durmuş] xanın qardaşı Hüseyn mirzə isə Məlik darvazasını mühafizə etməli idi. Durmuş xan qazilərdən ibarət bir dəstə ilə Sam mirzənin yanında qərar tutdu. O, əlverişli mövqe seçmişdi. Yəni onun hər darvazaya və bürcə qədər məsafəsi elə idi ki, hansı tərəfdən köməyə ehtiyac olarsa, özünü tezliklə oraya çatdıra bilsin.

Ertəsi gün Kuçum xan, Übeyd xan və digər sultanlar həmin vilayətin nahiyələrinə daxil oldular. Kuçum xan Şadmanə[1894] kəndini özünə məskən etdi. Übeyd xanla buxaralılar Ahu bağında qərarlaşdılar. Bahadırların bir dəstəsi ilə Sevincək sultan Murad bağında lövbər saldı. Əbu-Səid sultan isə Məran[1895] kəndində öz bargahının qübbəsini yüksəltdi. Uzun sözün qısası, sitəmkar özbəklər Herat şəhərini bir mərkəz kimi dövrəyə aldılar.

Beyt

“Halə ayın ətrafını əhatəyə aldığı kimi,
Heratın ətrafını halqa kimi sarımışdı həmin ordu”.

Pis xilqətli özbəklər Firuzabad darvazasına sarı üz tutduqları zaman Xoca Həbibulla və digər qoşun başçıları döyüşkən süvarilərlə və tüfəng atan piyadalarla birlikdə məhəllələrdən vüqarla çıxdılar, cürət küləyi ilə savaş atəşini alovlandırdılar, ox və tüfəng zərbələri ilə onları məğlubiyyətə uğratdılar. Ertəsi gün Übeyd xan və digər özbəklər atlanaraq küçəbəndin yaxınlığına gəldilər. Qazilər ölüm ahəngli tüfənglərin atəşləri ilə onları pərən-pərən saldılar.

Şeir

“Hər guşədən tüfəng buludu dolu saçdı,
Elə bir bulud ki, dolu ilə canlar aldı”.

---

[1893] Məclis və Nuruosmaniyyə nüsxələri: “Samuroğlu”. Bu şəxsin adı h. 925-ci lin hadisələri daxilində Sevəroğlu yazılmışdır.

[1894] Məclis, Nuruosmaniyyə və Bakı nüsxələri: “Şaymanə”; Baroda nəşri: “Şamyanə”. Hafiz Əbrunun coğrafiyaya dair əsərinin Heratdan bəhs edən hissəsi əsasında təshih edilərək Şadmanə yazılmışdır. Bu, Herat vilayətinin Alencan bölgəsində bir kənddir *(Nəvai, şərhlər, s.1138).*

[1895] Məclis nüsxəsi: “Bərar”. Hafiz Əbrunun coğrafiya əsərində belə bir ad tapmadıq *(Nəvai, şərhlər, s.1139).*

Həmin vaxt özbək qoşunları və Səfəvi xanədanının düşmənləri bir neçə dəfə döyüş meydanına atıldılar. Lakin hər dəfə o qeyrətsiz güruh məğlubiyyətə düçar olub ümidsiz və uğursuz surətdə geri çəkildi. Elə ki özbəklərin murad oxu öz hədəfinə çatmadı və səadət sübhü onların taleyinin üfüqündən doğmadı, onlar sülhə meyil edib məsələni dinc yolla həll etmək istədilər. Kuçum xan, Durmuş xana bir məktub (nişan) göndərdi. Məzmunu belə idi: "İnadkarlığı və düşmənçiliyi tərk edib şəhərdən çıxın və şəhərin açarlarını [mənə] təslim edin ki, biz də sizi öz əmirlərimizin sırasına daxil edək". Durmuş xan məktubun məzmunundan agah olduqda Sam mirzənin dilindən Kuçum xana bu məzmunda bir məktub (nişan)[1896] göndərdi: "Xaqanların ümdəsi olan Kuçum xan şahanə inayətimizdən əmin olsun və bilsin ki, lələm Durmuş xana göndərdiyiniz məktub bizim nəzərimizə çatdırılmışdır. Səndən nə əcəb ki, bu qədər savaşlar görməyinə, çoxlu yollar keçməyinə, siyasi işlərdə və münasibətlərdə təcrübə toplamağına baxmayaraq, belə istəklərə düşürsən? Gərəkdir ki, gündüz köç edib öz mülkünə gedəsən və şah dərgahının qılınc qurşananlarının qəzəbindən qorxub öz namusunu hifz etməyin qayğısına qalasan!"

Durmuş xanın göstərişi ilə bu məktubu Kuçum xana göndərdilər. Sözügedən şəxs məktubun məzmunundan xəbər tutduqdan sonra yenə də savaşı davam etdirdi.

Bir gün Durmuş xan öz xas adamlarından ibarət dəstə ilə Mirzə Əhməd sultan bürcünün üzərinə çıxdı və Qara İşik başda olmaqla mülazimlərdən bir hissəsini Murad bağına yolladı. Zəfər şüarlı əsgərlər sürətli atlara süvar olub, adı çəkilən bağa tərəf irəliləməyə başladılar. Onlar özbək gözətçilərinin mövqe tutduqları Sefid bağına çatdıqları zaman böyük bir döyüş baş verdi. Qantökən özbəklər döyüşkən şamlular qarşısında tab gətirməyib qaçış yoluna çıxdılar. Qaniçən dilavərlər və qorxusuz qazilər Sefid bağından keçib Murad bağına qədər [at] çapdılar. [Oraya çatdıqları vaxt] igidlərdən biri ağır gürz zərbəsi ilə bağın qapısını sındırdı. Təsadüfən, həmin vaxt Übeyd xan, Sevincək Məhəmməd sultanın yanına gəlmişdi. Onlar bir-biriləri ilə söhbət etdikləri vaxt bir dəstə özbək sərsəm və iztirablı bir halda onların yanına gəlib dedilər:

- Ayağa qalxın! Qızılbaş qoşunu və şamlular davada bizə üstün gələrək bağa daxil olmuşlar.

Sevincək Məhəmməd sultan çarəsizlik üzündən su arxına düşdü. Übeyd xan isə tamam qorxu içində özünü atına yetirib öz düşərgəsinə qaçdı. Qazilər oradan geri qayıtdılar. Lakin qazilərin bu cür qəhrəmanlıq və igidlik göstərmələri nəticəsində özbəklərə məlum oldu ki, Heratı döyüşlə tutmaq mümkün iş deyil və onlar köç edib öz vilayətlərinə yollandılar.

## 931-Cİ İLDƏ (29.10.1524 – 17.10.1525) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Div sultanla Köpək sultan Ustaclu arasında vəkillik vəzifəsi ("vəkalət") üstündə münaqişə baş qaldırdı. Həmin vaxt Div sultanın mülazimləri Çuxursəəddə idilər. O, ustaclu əmirləri qarşısında güzəşt etdi, Xorasana getmək və özbəklərlə savaşmaq üçün [şahdan] rüsxət alıb Lar yaylağına[1897] yollandı. Elə ki o, öz gəlişinin şəfəqlərini adı çəkilən yaylağın üzərinə saldı, Kəlhur[1898] valisi Çuxa sultan Təkəlüyə, Şiraz hakimi Əli sultan Zülqədəroğluya, Həmədan tiyuldarı Qaraca sultan Təkəlüyə və b. yüksək şanlı əmirlərə bu məzmunda məktublar yazdı: "Biz, dinin pənahı olan şahın əmrinə əsasən, öz məiyyətimiz və qoşunumuzla kinli özbəklər üzərinə gedirik. Gərəkdir ki, siz əzizlər də ittihad və birlik yolunu tutaraq öz əsgərlərinizi cəmləşdirəsiniz və Lar yaylağında zəfər şüarlı orduya qatılasınız". Məktubları çatdırmaq üçün qasidlər hərəkətə gəldilər. Həmin yay mövsümündə [Div sultan] orada yaylaq etdi. Mazandaran, Həzarcərib və Rüstəmdar hakimləri öz mülazimlərini saysız töhfələrlə o ali mənşəli əmirin dərgahına göndərdilər. Adlı-sanlı əmirlər çoxlu qoşunla Lar yaylağında ona qoşuldular. Div sultan [onlara] ziyafət təşkil etdi və peşkəşlər verdi. Ərğəvan qədəhləri gül üzlü saqilərin əlləri ilə [bu məclisdə] dövr etdi. Şənlik yaradan müğənnilərin nəğmələri və xoş avazlı mütrüblərin sədası Nahid işrətxanasına (Venera planetinə) gedib çatdı.

Şeir

"Məlahətli musiqinin səsini eşitdikdə,
Mələk göydə rəqs etməyə başladı.
Hər tərəfdə bir gözəl qız əlində xalis badə tutmuşdu,

[1896] Məclis nüsxəsi: "pərvanəçə".
[1897] Lar yaylağı (Larican) – Təbəristan (Mazandaran) vilayətinin hüdudunda, Dəmavənd və Firuzkuh arasında yerləşir.
[1898] Kəlhur – Bağdadla Kirmanşah arasındadır *(Seddon, şərhlər, s.257).*

Elə bil ki, bir ay öz əlində bir günəşi tutmuşdu.
Müğənni həsrət barmağını dişləri arasına alıb susmadı,
Əllərinə dəf götürdü və nəğməsini oxudu.
Udun telləri sanki pəri-peykərlərin zülfü kimi,
Məclisdəkilərin canlarından tüstü çıxarırdı".

Div sultan məktublar ("nişan"lar) yazdırmış, onları dinin pənahı olan şahın möhürü ilə möhürlətmiş və özü ilə gətirmişdi. [O, bu məktubları] Kaşana, Quma və İraqın digər vilayətlərinə göndərdi. O, həmçinin özü ilə cəbbə və cövşənlər gətirmişdi və bunları əmirlərin mülazimlərinə payladı. Beləliklə, ənam və ehsan dənələri ilə onların könül quşunu özünə ram etdi və hamısı ona tabe oldular. O, əmirlərə dedi:

- Dinin pənahı olan şah məni himayə etmək və yüksəltmək fikrində idi. [Lakin] Köpək sultan fəsad çıxardı. Buna görə də mən o diyarı tərk etməli oldum. Sizdən istəyim budur ki, səmimi-qəlbdən imdad kəmərini belinizə bağlayasınız və mən [sizin köməyiniz ilə] vəkillik (vəkalət) mənsəbini ondan ala bilim.

Əmirlər onunla ittifaq bağladılar və Təbriz üzərinə hərəkətə gəldilər. Elə ki Köpək sultan onların hərəkətindən xəbərdar oldu, öz yaxınları ilə məşvərət etdi. Qarınca bəy dedi:

- Div sultan haqtanımaz və vəfasız bir adamdır. O, dinin pənahı olan şahdan neçə-neçə rəğbətlər və şəfqətlər görməsinə baxmayaraq, indi bu nemətə qarşı nankor çıxmaq yolunu tutub şah həzrətlərinə münasibətdə bu cür rəftar edir. Yaxşısı budur ki, mülk bağışlayan Allahın kəreminə təvəkkül eyləyərək onların say çoxluğundan qorxmayaq və onların qarşısına çıxaraq döyüş və vuruş qapılarını onların üzünə açaq.

Köpək sultan bu sözü rədd edib dedi:

- Biz hər ikimiz şahın qulamlarıyıq və bu dərgahın dostlarıyıq. Bir-birimizlə düşmənçilik etməməliyik.

Daha sonra o, ta Türkman kəndinə qədər Div sultanı qarşılamağa çıxdı və oradan hamısı birlikdə aləmin pənahı olan dərgaha yollanaraq Çərəndabda[1899] [şahla] görüşmək şərəfinə nail oldular. Div sultan o fitnənin xəmirinin mayası olmuş Qarınca bəy Ustaclunu və Narın bəy Qacarı qətlə yetirdi[1900] və Qazı Cahanı tutub Luri[1901] qalasına göndərdi. Köpək sultanı isə o, cəmi ustaclularla bərabər Gürcüstan üzərinə qəzavata yolladı və onlar çıxıb getdikdən sonra ustaclulara məxsus tiyulları ləğv etdi. Köpək sultan müxaliflikdən əl çəkərkən ümid etmişdi ki, Div sultan vəkillikdə onu özünə şərik edəcəkdir. Amma bu istək baş tutmadı.

Şeir

"Mürüvvət ortadan qalxdı, vəfa yox oldu,
Simurq və kimya kimi bu ikisinin də sadəcə adı qaldı".

### Müxtəlif əhvalatlar

Bu il dinin pənahı olan şah ali divanın nəzarətini Əmir Cəfər Savəciyə həvalə etdi. Bu il içində Çuxa sultan, Köpək sultanın yerinə möhür vurdu. Və yenə də bu il [şahın] qışlağı Təbrizdə oldu.

### Ölümlər

Bu il Əbdi bəy Şamlunun oğlu Durmuş xan Heratda vəfat etdi. Dinin pənahı olan şah Herat hakimliyini onun qardaşı[1902] Hüseyn xana lütf etdi.

Bu il Şiraz valisi Əli sultan bu fani aləmdən əbədi dünyaya tələsdi. Dinin pənahı olan şah o diyarın hakimliyini Murad sultan Zülqədərə lütf etdi.

Sədr [vəzifəsində çalışan] Əmir Cəmaləddin Məhəmməd Astarabadi, Mövlana Cəlaləddin Məhəmməd Dəvvaninin tələbələrindən idi. O, daha sonra Heratda Mövlana Şeyx Həsən Möhtəsibin yanında "Şərhi-

[1899] Çərəndab – Təbrizin bir məhəlləsidir.
[1900] Məclis nüsxəsi: "Həmin məclisdə Div sultanın sözü ilə Qarınca bəy Ustaclunu və Narın bəy Qacarı qətlə yetirdilər. Çünki onlar bu fitnə-fəsadın xəmir mayası idilər".
[1901] Baroda nəşrində səhvən "Nuri" yazılmışdır. Bakı nüsxəsi: "Kuri". Luri – Mazandaranda bir qala *(Seddon, şərhlər, s.257).*
[1902] Baroda nəşrində səhvən "qardaşı oğlu" yazılmışdır. Məclis nüsxəsi: "Herat hakimliyini onun qardaşı Hüseyn mirzəyə verib onu xan rütbəsi ilə mükafatlandırdı".

təvale”[1903] (“Talelərin şərhi”) [əsərini] mütaliə etmişdi. [Yuxarıda] qeyd edildiyi kimi, axırda İsgəndər şanlı xaqanın [zamanında] sədr olmuşdu. Mirzə Şahhüseyn onunla kin-küdurətlə rəftar edirdi. Bu səbəbdən [Mirzə Şahhüseyn] Əmir Qiyasəddin Mənsuru ali taxtın ətəyinə çağırmışdı ki, onu [sədr vəzifəsində Əmir Cəmaləddin Məhəmməd Astarabadiyə] şərik etsin. Amma [bu iş] baş tutmadı və yenidən onlar arasında mübahisə baş verdi. Əmir Cəmaləddin Məhəmməd təbiətən məzəli və hazırcavab adam olduğuna görə bu mübahisəni zarafatla yoluna qoydu. Mir Qiyasəddin Mənsur məqsədinə çatmadan Şiraza yola düşdü. Mövlana Xəlilulla Münəccim Kaşi bu rübaini [həmin hadisə barəsində] nəzmə çəkmişdir:

Rübai

“Ey Mir, öz adına-sanına muğayat olub getdin,
Haqqın xəlifəsi səni təsdiq etmədi və sən çıxıb getdin.
Səni qarşıladıqları kimi hörmətlə yola salmadılar,
Əfsus[1904] ki, yaxşı gəldin, fəqət pis getdin”.

“Xatəmül-müctəhidin” (“müctəhidlərin möhürü”) ləqəbinə malik olan və peyğəmbərlər ağasının (Məhəmməd peyğəmbərin) elminin varisi sayılan Şeyx Əli[1905] əvvəlinci dəfə İraqi-Ərəbdən xilafət təyinatlı taxtın ətəyinə gəldiyi vaxt onunla [Əmir Cəmaləddin Məhəmməd Astarabadi] arasında zahiri dostluq əlaqəsi yaranmışdı. Mir [Cəmaləddin Məhəmməd Astarabadi] qərar verdi ki, Şeyx [Əli] onun yanında Mövlana Əli Quşçunun “Şərhi-təcrid” (“Təcrid şərhi”) [əsərinə] dair tədris alsın və o da Şeyx Əlinin hüzurunda “Kitabi-qəvaid” (“Qaydalar kitabı”) barəsində dərs öyrənsin. Mir dedi ki, [mənim sənə] kəlam [elmini] öyrətməyim üçün bu həftə yaxşıdır və [sənin mənə] fiqh tədris etməyin üçün gələn həftə münasibdir. Nəhayət, Şeyx Əli “Şərhi-təcrid”in ümumi qaydaları mövzusunda Mirin hüzurunda bir-iki dərs öyrəndi. Əvvəlcədən qərarlaşdırıldığı kimi, o biri həftə Mir [Şeyx Əlinin yanında] fiqh dərsi öyrənməli olduğu halda, özünü xəstəliyə vurub [Şeyx Əlidən] dərs almaqdan imtina etdi.

Həqiqətən də, müqəddəslik sarayının tədqiqatçısı olan Xoca Nəsirəddin Məhəmməd Tusidən sonra heç kəs haqq Cəfəri məzhəbinin və on iki imam əqidəsinin bəyan edilməsi sahəsində o həzrətdən (Əmir Cəmaləddin Məhəmməd Astarabadidən) daha artıq səy göstərməmişdi. Əxlaqsızlığın və pozğunluğun qadağan edilməsi və sıxışdırılması, bidətçi qaydaların aradan qaldırılması və ram edilməsi, günahların və imansızlığın rədd edilməsi, şəraba və sərxoşluğa qarşı mübarizə, əxlaqi məsələlərdə hədd-hüdudun gözlənilməsi, yaramaz əməllərin məzəmmət olunması, dini fərzlərə və vacibata riayət edilməsi, cümə və camaat [namazlarının] vaxtlarının dəqiqləşdirilməsi, orucun və namazın ehkamı, imamların və müəzzinlərin əhvalının təhqiqi, müfsidlərin (fəsadçıların) və xəbislərin şərinin rədd edilməsi və günah işlər törədənlərin dəf olunması istiqamətlərində mümkün qədər yaxşı səy göstərmiş, əhalini islam şəriətinin hökmlərinin təliminə rəğbətləndirmiş və həvəsləndirmişdi. O, bu il fani aləmdən köçdü. Onun cəsədini öz vəsiyyətinə uyğun olaraq, Kərbəlaya apardılar və orada dəfn etdilər.

## 932-Cİ İLDƏ (18.10.1525 – 07.10.1526) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın ustaclu əmirləri ilə müharibə etməsi

Bu il ustaclu əmirləri ölkələri əllərindən alındığı üçün müxaliflik etməyə başladılar. Köpək sultan rəcəb ayının (13.04.-12.05.1526) əvvəlində Xalxal yolundan Sultaniyyəyə gəldi. Məntəşa sultan, Qılıc xan, Qurd bəy və Bədir bəy ona qoşuldular və savaş meydanına üz qoydular. Div sultanla Çuxa sultan ustaclu əmirlərinin müxalifliyindən agah olduqda, miqdarını xəyal mühasiblərinin sayıb qurtarmaqda aciz qaldıqları qədər çoxsaylı bir qoşunla və dinin pənahı olan şah ilə birlikdə onlara qarşı hərəkət etdilər, gəlib Səksəncək mövqeyində dayandılar. Əmirlərin fikrindən keçdi ki, yenə də Köpək sultanla sülh bağlasınlar, fitnə alovlarını tədbir suyu ilə söndürsünlər, ortalıqda qalxmış olan vəhşət tozanağını və şölələnmiş fəsad atəşini öyüd-nəsihət zülalı ilə yatırsınlar. [Bu məqsədlə] onlar Qasım xəlifə Varsağı elçi sifəti ilə ustaclu əmirlərinin yanına

---

[1903] Məclis nüsxəsi: “Şərhi-mütaliə və onun haşiyəsi”.
[1904] Məclis nüsxəsi: “Əlqissə”.
[1905] Şeyx Əli əl-Kərəki – əslən Livanın Cəbəlamil bölgəsindən olan və Səfəvi sarayında xidmət edən şiə ilahiyyatçısı idi *(M.Çelenk. XVI. ve XVII. yüzyıllarda Safevî Şiîliği. Doktora Tezi. Bursa: Uludağ Üniversitesi Sosyal Bilimler Enstitüsü, 2005, s.187-198).*

göndərdilər, uzlaşmanın əsasını möhkəmlətmək və nifaq zəncirini qırmaq yönündə təkliflər irəli sürdülər. [Qasım] xəlifə Varsaq "Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşursa, onları dərhal barışdırın" ayəsinin[1906] zərurətinə əməl edib razılaşma köynəyini geyindi, barışıq əlini səmimiyyət qolçağından çıxardı, Köpək sultanın yanına gəldi və tərəflərin barışması üçün xeyli səy göstərdi. Amma asimani qəzavü-qədər üstün gəldi, şər atəşi şöləvləndi və iti qılıncdan savayı heç bir şeylə düşmənçiliyin kökünü kəsmək mümkün olmadı. Söhbətlər, məzəmmətlər və tənələr mübahisəyə gətirib çıxardı. [Ustaclu əmirləri] zülal suyundan və halal sehrdən[1907] daha faydalı olan nəsihətləri dəyərsiz və əhəmiyyətsiz toz-torpaq kimi qiymətləndirdilər, nurdan və alovdan daha parlaq öyüdləri külək kimi vəznsiz və etibarsız hesab etdilər.

Nəzm

"Kar ala bilməz xoş avazdan nəsib,
Ölüyə heç əlac edərmi təbib?
Öyüd nadana verməz istiqamət,
Su üstündə yazmaq olmaz nəsihət".

[Ustaclu əmirləri] hərb atəşini alovlandırmaq üçün tələsdilər, kama çatmaq üçün qaldırdıqları küləklə vəfadarlığın gözünün içinə toz saldılar, özlərinin şər işlərlə və yersiz düşüncələrlə dolu başlarını bir Ənqa quşu kimi fitnə Qafının arxasına çəkdilər. Onlar səmadakı günəş kimi böyük bir qoşunla, qılınc qurşanan, qalxan tutan əsgərlərlə, sayları ulduzların sayı qədər çox olan nizədarlarla və xəncər vuran cəngavərlərlə alovlu bir şəkildə hərəkətə keçib, savaş küləyinin dalğalandırdığı su kimi coşqun və hay-küylü bir şəkildə döyüş və vuruş meydanına yollandılar. Hər iki tərəf səflərin tərtibi, nizələrin və qılıncların döyüşə hazır vəziyyətə gətirilməsi ilə məşğul oldu. Bu tərəfdən ordunun mərkəzi dinin pənahı olan şahın bədirlənmiş ay misallı simasının nuru ilə bəzəndi. Div sultan və Çuxa sultan o həzrətin yanında dayandılar. Sağ cinahda ("meymənə"də) Burun sultan Təkəlü, Qaraca sultan Təkəlü və Əxi sultan Təkəlü durdular. Sol cinahda ("meysərə"də) Dəmri sultan Şamlu və Zülqədəroğlu Məhəmməd xan qərar tutdular. Ustaclu qoşunlarının isə ümid gözü mərkəz ("qol") tərəfdə Köpək sultanın bayrağının ayparasının nuru ilə işıqlandı. Sağ cinah ("bərangar") Məntəşa sultanın rövnəqi və şövkəti ilə möhkəmləndi. Sol cinah ("cəvangar") Qazaq sultanın qılıncının və nizəsinin parıltısından zinət tapdı. Elə ki həmin iki kinli ordu bu tərtiblə bir-birinin qarşısına çatdılar, zəmanənin ürəyi təəssüfdən qana döndü ki, gərək eyni soydan olan bu iki qoşun bər-biriləri ilə ittifaq edərək dövlətin yağılarını zəlil və məmləkətin düşmənlərini qəhr edəydilər.

Köpək sultanla Məntəşa sultan təkəlü əmirlərinin üzərinə[1908] at çapdılar. Minik heyvanlarının nallarının tozanağından günəşin gözü tutuldu və atların dırnaqlarından qalxan toz-torpaqdan dünya başına tozdan pərdə çəkdi.

Nəzm

"Atların qaldırdıqları tozanaq səbəbindən,
Torpaq asimana bülənd oldu.
Fələklərin gözündən tökülən toz-torpaqdan,
Yer öz əli ilə başına kül ələyirdi".

Köpək sultanla Məntəşa sultan nisan (aprel) ildırımı kimi cuşa gəlmişdilər və qamışlığa düşən şimşəktək qızmışdılar. [Ustaclular] hər iki tərəfdən basqın edirdilər və mübarizə aparırdılar. Hər qılınc zərbəsi ilə bir aslanı yoxluq diyarına yollayırdılar və hər ox atışı ilə bir pəhləvanı həlak torpağına sərirdilər.

Nəzm

"Onlar addım atdıqları hər tərəfə,
Qamışlığa düşmüş atəş kimi irəliləyirdilər.
Torpaq qandan tanınmaz hala gəlmişdi,
Hamısı qətl meydanına at çapırdılar.
Hər iki dəstə bir-birinə həmlə edirdi,

[1906] *Qurani-Kərim, "Hücərat" surəsi, 9-cu ayə.*
[1907] Halal sehr – bir beytdə həm öncəki, həm sonrakı kəlmələrlə anlamı bütünləmə sənəti; insanı valeh edən, qeyri-adi dərəcədə gözəl söz (bax: *M.O.Okay. Sihr-i Helâl // TDVİA, cilt: 37, yıl: 2009, s.172-173*).
[1908] Məclis nüsxəsi: "Köpək sultan və ustaclu əmirləri təkəlülər üzərinə".

Ölülərin cəsədlərindən dağlar yaranmışdı”.

Təkəlülər məğlub oldular. Burun sultanla Qaraca sultan qətlə yetirildi. Ustaclular [təkəlüləri] təqib edərək [şah ordusunun] mərkəzinin arxasına doğru dolandılar[1909]. Süleyman məkanlı padşah, qorçuların bir dəstəsi ilə[1910] onlara həmlə etdi.

Nəzm

“Sabit qədəmli və mələklər ordusuna malik,
Səadət bağının gülü Təhmasib şah.
Qızmış aslan kimi igidliklə cövlan edib,
Meydan ahəngi ilə atını oynatdı”.

Yüksək uçan şahbaz kimi şığıyan Köpək sultan hökmdarın çətirini səadətin qanadları kimi açılmış gördükdə quş kimi iztirabın əsiri oldu, ayağını savaş meydanından geriyə qoydu, yüyənini nakamlığın əlinə verib, az adamla, fəqət çoxlu xofla fərar vadisinə tələsdi. Qorçular onları təqib etdilər və bir hissəsini qətlə yetirdilər. Ustaclu əmirləri Əbhər hüduduna gəldilər. Orada arxadan sürətlə gələn təkəlülər onlara çatdılar. [Ustaclular] çarəsiz qalıb Rəşt hakimi Müzəffər sultana pənah apardılar.

Müzəffər sultan onların köməyinə səkkiz min piyada göndərdi. Bu xəbər orduya çatdıqda, dinin pənahı olan şah öz ordugahını Xalxalda qoyub sürətlə irəli atıldı. O, Div sultanı, Çuxa sultanı, Məhəmməd xan Zülqədəroğlunu, Əxi sultanı və Dəmri sultanı ön dəstə (“mənqəlay”) təyin etdi. Onlar Xərzəvil[1911] ətrafına çatdıqda, qəflətən Köpək sultan, Məntəşa sultan, Qazaq[1912] sultan, Qurd bəy, Bədir bəy və Qılıc xan [öz qoşunlarının] mərkəzini, sağ və sol cinahlarını tərtib etmiş şəkildə, yırtıcı aslan və qorxulu bəbir kimi Gilan cəngəlliyindən çıxıb onların qarşısında səf qurdular. Həmin iki qaniçən qoşun və həmin iki coşqun dəniz təlatümə gəldi. Döyüş mərəkəsinin tozanağı yüksəldi. İti qılınclar başçıların başlarını zillət torpağı üzərinə tökməyə başladı.

Nəzm

“Yerə o qədər baş, əl, ayaq töküldü ki,
Savaş meydanında yer qalmadı.
Qılıncların ucundan o qədər qan damdı ki,
Buluddan yüz ildə bu qədər yağış yağmamışdı”.

Axırda İlahi zəfər yeli şah əmirlərinin bayrağını yellətdi. Köpək sultan ayağını fərar vadisinə qoydu. Əmirlər onları təqib etdilər və əksər gilәkləri qətlə yetirdilər. Köpək və Məntəşa[1913] kəklik kimi qartal caynağından xilas olub böyük məşəqqətlə Gilana getdilər.

**Babur padşahın əfqanlarla müharibə etməsi və onun Hindistanı ələ keçirməsi haqqında söhbət**[1914]

Bu il Bəhram kimi cəsur olan Zəhirəddin Məhəmməd Babur Bəhrə[1915] vilayətinə yola düşdü. Ali məqamlı padşahın hərəkətindən xəbər tutan əfqan ordusu o diyarı tərk edib qaçdı. Babur padşah həmin vilayəti öz mülazimlərindən birinə tapşırıb Kabil tərəfə qayıtdı. Yenə bu il o, Lahor[1916] tərəfə yollanıb o bölgəni də ələ keçirdi. Hind valisi olan Sultan İbrahim səhralıqdakı qum dənələrindən çox və möhtəsiblərin hesabından artıq bir qoşunla savaş meydanına irəlilədi. Onun ordusunda dağ cüssəli və heybətli fillər vardı.

Beyt

“Hamısı asiman şövkətli, iri fillər idi,
Enləri dəniz qədərdi, hündürlükdə dağ boyda idilər”.

[Sultan İbrahimin] xəyalı o idi ki, Babur padşah onun gəlişindən xəbər aldıqda Lahoru qoyub Kabilə dönəcəkdir. Amma onun təsəvvürünün əksinə olaraq, Babur padşah kin qılıncını qınından sıyırdı, qələbə

[1909] Bakı nüsxəsi: “Ustaclular mərkəzə həmlə etdilər”.
[1910] Məclis nüsxəsi: “Aləmin pənahı olan padşah, kinli qorçuların bir dəstəsi ilə”.
[1911] Xərzəvil – Qəzvin yaxınlığında kənd *(Seddon, şərhlər, s.258).*
[1912] Nuruosmaniyyə nüsxəsində səhvən “Qazan” yazılmışdır.
[1913] Məclis, Nuruosmaniyyə və Bakı nüsxələri: “Məntəş”.
[1914] Bakı nüsxəsi: “Babur padşahın Sultan İbrahimlə müharibə etməsi və o diyarı ələ keçirməsi haqqında söhbət”.
[1915] Bakı nüsxəsi: “Nəhrə”.
[1916] Lahor – müasir Pakistanda şəhər, Pəncab əyalətinin inzibati mərkəzi.

ayətli bayrağını yüksəltdi və qeyri-məhdud bir qoşunla Sultan İbrahimin üzərinə yeridi. Panipat[1917] mövqeyində tərəflər bir-biri ilə qarşılaşdılar. Meydandan qalxan tozanaq Fərqədan [ulduzlarının] başına oturdu. Həmin iki şövkətli güruh acıqlı arılar kimi bir-birinin üzərinə tökülüşdülər və bir-birinin başlarına gürz və qılınc vurdular.

Şeir

“Dəbilqəni kəsə bilən iti qılıncdan,
Dəbilqə parçalandı və [qılınc] göbəyə qədər işlədi.
Ağır gürz sərvərlərin başlarının dərdidir,
Və bu dərddən sərvərlərin başı gicəllənir”.

Fələyin nidası və mələyin sədası Babur padşahın huş qulağına çatdırdı ki, “Məgər Rəbbinin Fil sahiblərinə nələr etdiyini görmədinmi?!”[1918]. Sultan İbrahimin döyüşçüləri filləri irəli çapdılar. Cağatay ordusu ox və tüfəng zərbələri ilə onların əksərini yaraladılar və öldürdülər.

Beyt

“Xortumlu döyüş filləri hər tərəfdən,
Xədəng oxları ilə doldu qəndil kimi”.

Hindlilər döyüş meydanını tərk edib qaçış biyabanına[1919] üz qoydular və o diyarda onlardan heç bir canlı qalmadı[1920].

Nəzm

“Evi yanmış zənci qaçaqaça düşdü,
Gecənin dəstəsi gündüzün türkündən qaçan kimi.
Divlər ümidsiz olub canü-dildən hürkdülər,
Qarğalar ağ qartaldan qorxan kimi.
Qaralar[1921] qara torpaqla yeksan oldular,
Ordu paymal olub kölgə kimi yerə sərildi.
Tüfəng şimşəyindən dəliqanlıların və dikbaşların hamısı,
Atəşdən çıxan tüstü kimi qaçıb dağılışdılar”.

Sultan İbrahim xof və qorxu ilə bir viranəliyə pənah apardı. Babur padşahın mülazimləri onu tutub qətlə yetirdilər. [Babur] Dehli hakimliyini Qutluq Qədəmə verib Aqraya yola düşdü və Hind vilayətini zəbt etdi.

### Übeyd xan Özbəyin Tus şəhərini ələ keçirməsi haqqında söhbət

Dərgah əmirlərinin ixtilafı, Xoca Həbibullanın qətli, yolsuz-yordamsız şamluların [Xorasandakı] istilası, Durmuş xanın ölümü, Burun sultanın qətli və Xorasanın pərişanlığı [haqqında xəbərlər] Übeyd xana çatdıqda, o, Amudərya çayını keçib Mərvə gəldi. Oradan məiyyəti və ordusu ilə Tus şəhərinə yollandı, sultanlardan və bahadırlardan ibarət bir zümrə ilə həmin şəhərin ətrafına vüqarla qədəm qoydu və şəhəri dairə kimi araya aldı. O zaman Burun sultanın ailəsi və köçü həmin məkanda idi. Qazilər [özbəkləri] dəf etmək və onlara mane olmaq üçün şəhərdən çıxıb döyüşdülər. Qırğın və mübarizə səhərdən axşamüstünə qədər davam etdi və [axırda] qazilər şəhərə döndülər. Übeyd xan oranı dövrəyə aldı. Qazilər neçə ay[1922] ərzində mühasirədə oturub səbir etdilər. O əsnada mühasirədəki qoşunun arasında aclıq alovu geniş yayıldı. Acların ürəyinin tüstüsü atəş kürəsini dəlib keçdi. Azuqənin azlığı o dərəcəyə çatdı ki, köhnə dəriləri qaynadıb yeyirdilər. Atları olan bəziləri atların damarını kəsib qanlarını içirdilər və atlara yem kimi çubuq yonub saman əvəzində verirdilər.

Nəzm

[1917] Panipat – Hindistanın Haryana ştatında, Dehlidən 90 km. şimalda şəhər.
*[1918] Qurani-Kərim, “Fil” surəsi, 1-ci ayə.*
[1919] Baroda nəşri: “meydanına”; Bodleian nüsxəsi: “viranəsinə”; Məclis nüsxəsi: “vadisinə”.
[1920] Panipat qələbəsi 7 rəcəb 932 / 20 aprel 1526-cı ildə baş vermişdir. Bu zəfər nəticəsində Baburun Hindistan üzərində hakimiyyəti bərqərar olmuşdur *(Nəvai, şərhlər, s.1150).*
[1921] Məclis nüsxəsi və Baroda nəşri: “ordular”.
[1922] Məclis nüsxəsi: “altı ay”.

“Qıtlıq o həddə gəlib çatdı ki,
Çörək həyat suyu kimi tapılmaz oldu.
Qarnı ac olanlar dəriyə və yuna göz dikdilər,
Çünki dəri ətin qonşusudur”.

Qazilər Xorasan hakimlərinin yanına [adam] göndərib kömək istədilər. [Lakin] heç kəs fəryada yetmədi. Mühasirədəkilərin möhnəti taqət həddini ötüb keçdi. Özbək qoşunları onlara qalib gəldilər və adı çəkilən vilayət (Tus bölgəsi) o yaramaz qövmün əlinə keçdi. Übeyd xan öz etibarlı adamlarından birini orada qoyub Astarabada yollandı.

**Kəskən Qara sultan Özbəyin Bəlxi tutması**

Bu il Canibəy sultanın oğlu Kəskən Qara sultan məhsul yığımı vaxtı bir çox məchul özbəklərlə Bəlxin ətrafına gəldi. Məhəmməd Zaman mirzə həmin şəhərə sığındı. İki ildən sonra Babur padşah onu çağırdı və Məhəmməd Zaman mirzə Bəlxi qoyub Aqraya yönəldi. Kəskən Qara sultan Bəlxi ələ keçirdi. Məhəmməd Zaman mirzə Aqraya çatdıqda, Babur padşah ona hörmət göstərib min tümən məbləğində [gəliri olan] bir ölkəni ona lütf etdi.

**Zeynəddin sultanın Cağatay Bahadırla savaşı**

Bu il Cağatay Bahadır alçın[1923] geyimli üç min[1924] süvari ilə coşqun və hay-küylü bir şəkildə Xorasana basqına gəlib oranı qarət etdi və geri dönüş üçün bayrağını ucaltdı. İsfərayin hakimi Zeynəddin sultan Şamlu bu xəbəri eşitdikdə, Mahmud bəyi mülazimlərin bir dəstəsi ilə özbəklərə qarşı savaşmağa göndərdi. İsfərayinin altı fərsəxliyində müzəffər ordu dinsiz özbəklərə çatdı. Tərəflər döyüş ləvazimatına əl atdılar. Qırğın və mübarizə o səviyyəyə çatdı ki, bu tərəfin (qızılbaşların) altı yüz süvarisindən üç yüzü öldürüldü, özbəklər tərəfindən isə üç min nəfərdən yeddi yüz nəfəri qətlə yetirildi. Gecə olduqda fələk şahsüvarının araya girməsi ilə tərəflər döyüş meydanından yüyənlərini geri çəkdilər. Özbək ordusu Buxara yoluna çıxdı və qazilər İsfərayinə qayıtdılar[1925].

**Müxtəlif əhvalatlar**

Bu il dinin pənahı olan şah Qəzvində qışlaq etdi. Həmçinin bu il Lahican hakimi Karkiya Əhməd Qəzvində müzəffər padşahın yanına gəlib onunla görüşdü və [daha sonra] öz vətəninə döndü.

**Xoca Həbibullanın öldürülməsi**

Durmuş xanın vəziri Xoca Həbibulla Savəci[1926] bir gün nərd oynamaqla məşğul idi. Maaşlarını ala bilməyən şamlu camaatı xocanın yayına gəlib yüksək səslə dilləndi:

- Bir halda ki məvaciblərimizi ala bilmirik, bizləri nökərlikdən (xidmətdən) xaric et!

Xoca dedi:

- Sizlərə rüxsət verdim (xidmətdən azad etdim).

Bu sözdən sonra onlar dedilər:

- Bəs elə isə bizə bu barədə yazılı bir kağız ver!

Xoca öz qürurunun çoxluğu üzündən dəvat və qələm istədi, öz əli ilə onların rüxsətini yazıb möhürlədi və onlara təhvil verdi. Şamlular dərhal öz sərdarları olan Yar Əhməd xəlifənin yanına getdilər və xocanın sözlərini ona çatdırdılar. Yar Əhməd onlarla birlikdə xocanın evini əhatə etdi. Xocanın mülazimləri onla-

[1923] Alçın – Fərqanədə istehsal edilən kustar parça növü *(К.К.Юдахин. Киргизско-русский словарь. Книга I. Фрунзе, 1985, с.53).* Alçın sözü Orta Asiyada uzunluq vahidi, qoşunun avanqardı və tayfa adı kimi də işlənməsinə baxmayaraq, burada geyimlə əlaqəli olduğu üçün parça növü anlamı kontekstə daha uyğundur.

[1924] Məclis nüsxəsi: “otuz min”.

[1925] Məclis nüsxəsi: “Hər kəs öz məskəninə qayıtdı”.

[1926] Xoca Kəriməddin Həbibulla Savəci 7 səfər 928 / 6 yanvar 1522-ci ildə Herata gəlmiş və Herat hakimi Durmuş xan Şamlunun vəziri təyin edilmişdir. Məşhur salnaməçi Qiyasəddin Xandəmir özünün “Həbübüs-siyər” adlı müfəssəl tarixi əsərini bu vəzirin təşviqi ilə qələmə almış və onu Xoca Həbibullanın adının şərəfinə “Həbibüs-siyər” adlandırmışdır *(Nəvai, şərhlər, s.1153).*

rı dəf etməklə məşğul oldular. Axırda şamlular güc gəlib xocanın iki oğlunu qətlə yetirdilər və xocanın yüz nəfərdən ibarət olan bütün əqrəbalarına və nökərlərinə ölüm şərbətini içirdilər. Dərviş bəy Rumlu, xocanı tutdu. Sözügedən [xoca] ondan iltimas etdi ki, "məni Sam mirzənin yanına aparın və əgər məni öldürmək lazımdırsa, o öldürsün". Dərviş bəy onun başına bir paltar[1927] saldı ki, kimsə onu tanımasın. [Amma] şamlulardan bəziləri onu tanıyıb qətlə yetirdilər.

O, çox səxavətli idi. Ramazan ayında özünə yetəcək qədər məbləğ saxlayar, artıq pulunu isə ət almağa imkanı çatmayan insanlara paylayardı. Qışın əvvəllərində çılpaq möhtaclara hərarətli pambıq və dəri paltarlar hədiyyə edərdi. Göstəriş vermişdi ki, möhtac (yoxsul) xəstələr dava-dərmanı onun [şəxsi] şərbətxanasından götürə bilərlər[1928]. Öz mülazimlərindən birini təyin etmişdi ki, hər gün vilayətin ətrafını dolansın və əgər ölmüş bir qərib olarsa, onu kəfənə tutdurub [basdırsın]. Elə ki böyüklərdən[1929] biri onunla söhbətə gələrdi, ondan soruşardı:

- Əgər sənin [olduğun yerin] həndəvərində bir möhtac və ya elm tələbəsi olarsa, mənə xəbər ver ki, onun ehtiyacını ödəyim[1930].

## 933-CÜ İLDƏ (08.10.1526 – 26.09.1527) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Div sultanla Çuxa sultanın Şərur mövqeyində ustaclu əmirlərinə qarşı müharibə etməsi, onların (ustacluların) məğlub olması[1931] və Köpək sultanın öldürülməsi

Köpək sultan dilavərlərin basqınından sonra Gilana getdiyi zamandan etibarən gecə-gündüz o fikirdə idi ki, görəsən, onun muradının çöhrəsi məqsəd aynasında necə təzahür edəcək və əcəba, hansı şahmat taxtası üzərində öz ümid daşını qəm dünyasından çıxara biləcək? Buna görə də o, həmin vaxt çoxsaylı bir qoşunla Gilandan çıxıb öz hərəkət bayrağını Ərdəbil tərəfə yüksəltdi. Şərəfli ömrü yaşayış mərhələlərindən doxsan mərhələ qət etmiş (yaşı doxsana çatmış) və yaşının çoxluğu səbəbindən ağlının cövhərinə tamamilə xələl gəlmiş Badıncan sultan Rumlu Ərdəbildə sakin idi. O, Ayqut bəy Rumlu, Maqsud bəy Çepni, Talış əmirləri və təxminən üç min səkkiz yüz süvari ilə onların qarşısını kəsməyə tələsdi. Qaradərədə [iki qoşun] bir-birinə çatdı və səf qurdular. Məntəşa sultan savaş tozanağını səadət gözünün tutiyası bilən və həyat suyunu döyüş meydanının zülmətində axtaran bir dəstə qazi[1932] ilə onların mərkəzinə həmlə etdi.

Badıncan sultan çoxlu qoşuna və hədsiz qürura malik olmasına baxmayaraq, binamusluq külünü başına töküb az miqdarda adamın qarşısından qaçdı. Ustaclular onları təqib etdilər. O vaxt Qazuq sultanın[1933] tuğaçısı[1934] olan Əhməd ağa Çavuşlu, Badıncan sultanı qətlə yetirib başını əmirlərin yanına apardı. Ustaclular Ərdəbil şəhərinə daxil oldular, övliyaların sultanı olan Həzrət Şeyx Səfiəddin İshaqın ziyarətinin ehramını bağlayıb tamam ədəblə, son dərəcə təzimlə və ehtiramla ziyarət şərtini yerinə yetirdilər və hərəkət bayrağını Təbriz tərəfə qaldırdılar.

Badıncan sultanın vuruşmada qətlə yetirilməsi və ustaclu əmirlərinin Təbrizə getməsi xəbəri dinin pənahı olan şaha çatdıqda o, Div sultanı, Çuxa sultanı və Zülqədəroğlu Məhəmməd xanı səkkiz min nizədar süvari və min nəfər xasseyi-şərifə qorçusu ilə onlara qarşı savaşa göndərdi. Əmirlər tam sürətlə üsyankarların üzərinə yürüdülər. O zaman ustaclular Təbrizə çatmışdılar. Lakin Div sultanın gəlişindən xəbər tutan kimi Çuxursəədə tələsdilər. Çox cəsur əmirlər Şərur hüduduna çatdıqda Köpək sultan qılıncla qayanı zərrə-zərrə parçalayan və hər birisi tükü hədəf ala bilən ox atışları ilə zirehi yüz parçaya ayıran dilavərlərlə birlikdə gözlənilmədən peyda oldu. Təxminən min nəfər süvari həmin fil kimi heybətli, ilantək yara vuran və qarışqa qədər çox olan ordunun önündə səf qurdu.

Nəzm

[1927] Bakı nüsxəsi: "çadra".
[1928] Məclis nüsxəsi: "Göstəriş vermişdi ki, onun şərbətxanasına yol aparan hər xəstəyə ehtiyacı olan hər şeyi versinlər".
[1929] Məclis nüsxəsi: "... hər gün şəhərin və vilayətin ətrafını və yan-yörəsini gəzsin və əgər ölmüş bir qərib olarsa, [onu] kəfənləsin və [dəfn zərurətini] təchiz etsin. Elə ki böyüklərdən və kiçiklərdən...".
[1930] Məclis nüsxəsi: "... və o şəhərin əksər tələbələri və digərləri onun ənamından həzz alardılar".
[1931] Məclis nüsxəsi: "Ustaclularla təkəlülərin Hərurda (Şərurda) müharibə etməsi, ustacluların məğlubiyyəti...".
[1932] Məclis nüsxəsi: "süvari".
[1933] Məclis nüsxəsi: "Köpək sultanın".
[1934] Bakı nüsxəsi: "təvaçısı".

“Hamısı polad dırnaqlı atların üzərində idi,
Polad dənizində gövhər kimi itmişdilər.
Onların dəmir ürəklərinə qranit həsəd aparırdı,
Əcəl qılıncı kimi hamısı amansız idi”.

Əmirlər sürətli hərəkətin ardından dayandılar və ordunun hazırlığı ilə məşğul oldular. Div sultan mərkəzdə yerləşdi. Çuxa sultan sağ cinahda mövqe tutdu. Zülqədəroğlu Məhəmməd xan ehtiyatda qərarlaşdı.

İlk öncə igidlik və mərdlikdə dövranın yeganəsi olan Tacəddin bəy göz qamaşdıran şimşək və şiddətli külək kimi qoşunun mərkəzinə at çapdı və ordunun səfini yarıb, qoşunun arxasında olan yedək atların arasına çatdı. Onun arxasınca Köpək sultan, Məntəşa sultan, Qazuq sultan[1935], Bədir bəy və digər ustaclular həmlə etdilər. İgidlərin nizəsinin şöləsi cavanların həyat xırmanını yandırdı və pəhləvanların həmləsinin küləyindən kin atəşi yayıldı.

Nəzm

“İti nizə qiyamət atəşini alovlandırdı,
Öz kəskin xasiyyəti ilə aləmə atəş tökdü”.

İti dilli qılınc pis xasiyyətli düşməni sakitləşdirirdi və kaman son dərəcə lovğalıq və təkəbbür ilə arxasını müxalif tərəfə çevirib rəqibi zillət torpağı üzərinə salırdı. O gün ustaclu dilavərləri elə bir savaş göstərdilər ki, cahan sakinləri Rüstəm və İsfəndiyar dastanını unutdular. Div sultanla Çuxa sultana gəldikdə isə, bu iki nəfər:

Nəzm

“Mizrağın ucu və xədəng oxları ilə,
Xurşidin üzündəki ləkəni vururdular”.

Döyüş və vuruş vaxtı Zülqədəroğlu Məhəmməd xan ustacluların böyründən daxil oldu və amansız qılıncla onları vurmağa başladı. O, illərlə öz xatirində saxladığı arzunun bir zərrəsinin də ürəyində qalmasına imkan vermədi[1936]. Köpək sultan, Tacəddin bəy və Dərviş bəy dilavərlərin bir dəstəsi ilə birlikdə qətlə yetirildilər. Məntəşa sultanla Qazuq sultan[1937] ordunun səfini yarıb aradan çıxdılar və çoxlu məşəqqətlə özlərini Gilana yetirdilər. Adlı-sanlı əmirlər saysız qənimətlərlə ali dərgaha üz tutdular və Zəncanərudda [şahın] ordusuna qoşuldular.

**Übeyd xan Özbəyin Əxi sultan və Dəmri sultanla müharibə etməsi və onların öldürülməsi**

Bu il Übeyd xan fil cüssəli bir qoşunla və səf yaran bahadırlarla hərəkət bayrağını Astarabad tərəfə qaldırdı. O yaramazın həmin hüduda gəlişindən sonra Zeynal xanın qaravulları Qayapa bəy Qacarın[1938] başçılığı ilə mətanət qədəmini irəli qoyub mərdliklə savaşdılar. Bəzi qazilər çarəsizlik əlini “taqət gətirmədiyin şeydən qaçmaq lazımdır” kəlamına vuraraq [qaçdılar]. Amma o çoxsaylı ordunun sərdarı Qayapa bəy Qacar qüvvətli bəbir kimi özbəklərin ciyərini sökürdü və hər həmləsində müxalifləri vəhşi ov heyvanıtək qovurdu.

Nəzm

“Onun atdığı oxların zərbəsindən,
Beyin yuvasındakı arılar ölürdü.
Nizəsinin tiyəsini havada kinlə oynadanda,
Gah ürəyi deşirdi, gah sinə yandırırdı.
Qılıncını yellətdiyi vaxtlarda,
Havadakı kərkəsləri kabab edirdi”.

[Qayapa bəy Qacar] təxminən dörd fərsəx [irəliləyərək] coşqunluqla və hay-küylə savaşdı. [Lakin] axırda məğlub olub geri qayıtdı. Zeynal xan tabeçilərinin köçünü götürüb Rey vilayətinə yollandı. Übeyd

---

[1935] Bakı nüsxəsi: “Qazaq sultan”.
[1936] Zülqədəroğlu Məhəmməd xan Mərəş və Əlbistanın hakimi, Zülqədər bəyliyinin başçısı Əlaüddövlə bəyin nəvəsi idi. Onun atası Şahrux bəy 1508-ci ildə ustaclularla döyüşdə həlak olmuş, Məhəmməd isə əsir alınaraq Şah İsmayılın yanına göndərilmişdi. Sonradan ona əmirlik verilmiş və o, Səfəvi dövlətinin xidmətində dayanmışdı. Burada Məhəmməd xanın öz atasının intiqamını ustaclulardan aldığına işarə edilir.
[1937] Bakı nüsxəsi: “Qazaq sultan”.
[1938] Baroda nəşri: “Qayapa bəy Ustaclunun”.

xan Astarabad vilayətini öz oğlu Əbdüləziz sultana həvalə edib Bəlx tərəfə döndü. Zeynal xan dinin pənahı olan şahın Xorasan camaatına köməyə göndərdiyi Əxi sultanı və Pirqulu sultanı özünə qoşub Astarabad tərəfə qayıtdı. Əbdüləziz sultan onlardan qaçıb, ağlar və sızlar bir halda atasının yanına gəldi və hadisənin təfsilatını söylədi. Übeyd xan bu xəbəri eşitdikdə heyrət tüstüsü başına vurdu və qeyrət atəşi onun içində şölələnməyə başladı. O, Bistama yollandı. [Özbək] ordusunun ön dəstəsi (mənqəlayı) həmin şəhəri qarət etdi. Amma o diyarın daruğası bir özbəyi qətlə yetirib başını Astarabada apardı. Özbəklərin [fəaliyyəti] barədə Astarabadda[1939] xəbər alan Əxi sultan silah qurşanıb[1940] o diyara yollandı. Bistam tərəfə çatdıqda qaraltı müşahidə etdilər. Aydın oldu ki, Übeyd xandır. Dəmri sultan dedi:

- Yaxşısı budur ki, şəhərə (Astarabada) qayıdaq və dinin pənahı olan şahın yanına bir adam göndərib [vəziyyəti ona] bildirək.

Əxi sultan dilə gəlib dedi:

Beyt

“Qılınc ilə kamandan başqa məndən,
Heç nə görə bilməz bədgüman düşmən”.

Übeyd xan ordunun tərtibinə başladı. Qərarlaşdırıldı ki, Qənbər Əli igidlik yolunun yolçularının bir dəstəsi ilə sol cinahda (“cəvanğar”da) mövqe tutsun, Zinəş Bahadır isə cəsur kişilərdən ibarət bir dəstə ilə sağ cinahda (“bərənğar”da) döyüş meydanına üz qoysun. Bu tərəfdən Əxi sultan mərkəzdə qərar tutdu, Dəmri sultanı sağ cinahda (“meymənə”də) saxladı, sol cinah mövqeyini isə Şahəli bəyə[1941] həvalə etdi. Qazilər xeyli dəhşət və məcburiyyət qarşısında döyüş ləvazimatına əl atdılar. Təəssüf ki, qazilər iki min beş yüz süvari idilər, özbəklər isə iyirmi mindən artıq idilər. Şeypur və zurna sədaları asimanın mavi küpünə səs saldı. Dilavərlər hücuma keçdilər. Özbəklər onları dəf etmək üçün irəli atılıb həmlə küləyi ilə ölüm atəşini alovlandırdılar. Dilavərlər də özbəklərə həmlə etdilər. Günəşin nur bəxş edən gözü mərəkənin tozanağından tutuldu. Parlaq ulduzların gözləri ordunun qaldırdığı toz-torpaqdan qaraldı və görməz oldu.

Nəzm

“Yerdən elə bir tozanaq qalxıb hər tərəfə yayıldı ki,
Nə aşağıda, nə yuxarıda səma görünməz oldu”.

Dəmri sultan inadkar düşmənləri nizə yarası ilə yerindən dəbərdib özünü mərkəzə yetirdi. Özbəklərin çoxsaylı bir dəstəsi mərkəzdən xeyli həmlələr etdi və Dəmri sultanı öz yolundan kənarlaşdırıb qızılbaş ordusunun mərkəz (“qol”) hissəsinin arxasına keçdi. Əxi sultan özünü Übeyd xanın mərkəzinə vurub qılıncını oynatdı, lakin özbəklərdən birinin vurduğu yara ilə atdan düşdü. Übeyd xana qələbə müyəssər oldu və Dəmri sultan da igidliyini və pəhləvanlığını zahir etdikdən sonra əbədi dünyaya tələsdi (öldürüldü). Əxi sultanı diridiri Übeyd xanın yanına apardılar. O, Übeyd xana neçə-neçə söyüşlər dedi və onun hökmü ilə qətlə yetirildi.

Zeynal xan bu xəbərləri eşitdikdə, Astarabadı tərk edib Firuzkuha getdi. Übeyd xan Astarabadın idarəçiliyini Zinəş Bahadıra verib özü Herata yollandı və Quryanda[1942] qışlaq etdi.

**Rum vilayətində baş vermiş hadisələr və Sultan Süleymanın Firəng kafirləri ilə müharibə etməsi haqqında söhbət**

Bu il Rum padşahı Sultan Süleyman o hüdudun və o ölkənin qoşununu cəmləyib Engirüs diyarına yollandı. Rumilər dəstə-dəstə yola çıxdılar. Tuna (Dunay) çayının kənarına çatdıqda xondgar hökm etdi ki, çayın üstündən körpü salsınlar. Tabeçilər dərhal məharətli əllərini işə saldılar və mötəbər bir körpü hazırladılar. Rumilər [onun üzərindən] keçdilər. Afrendiş Kral[1943] və Erdel Ban[1944] Tuna çayının kənarında, Mohaç[1945] mövqeyində öz ordularını toplamışdılar. Bütün topları və arabaları öndə yerləşdirmiş, öz yerlərini möhkəmlətmiş, müharibəyə və vuruşmaya hazır vəziyyətə gəlmişdilər. Xondgar əksəriyyəti qaniçən olan çoxlu ordu

---

[1939] Tehran çapında səhvən “Bistamda” yazılmışdır.
[1940] Məclis nüsxəsi: “Übeydin xəbəri gəlib çatdı. Əxi sultan əmirlərlə birlikdə silah qurşanıb...”
[1941] Məclis nüsxəsi: “Şahəli sultana”.
[1942] Quryan – indiki Əfqanıstanın şimal-qərbində, Herat şəhərindən qərbdə yerləşən şəhər.
[1943] Məclis nüsxəsi: “Frendiş Kral”. Macar kralı Layoş nəzərdə tutulur.
[1944] Erdel vilayətinin hakimi Yanoş Zapolyo nəzərdə tutulur.
[1945] Mohaç – Budapeştdən 190 km. cənubda, Dunay çayının sağ sahilindədir.

ilə səf bağlayıb [onların] yaxınlığına çatdıqda, kafirlərin qoşunları süvar olub döyüşə üz tutdular. Tüfəngçilər həmin üzüqaranın (kralın) ordusunun önündə durub savaşa və vuruşa hazır idilər.

Bu tərəfdən isə xondgar iltifat şəfəqini ordunun tərtibi üzərinə saldı. Onun işarəsi ilə İbrahim paşa sağ cinahda ("meymənə"də) qərar tutdu. Sol cinahda ("meysərə"də) Qasım paşa, Fərhad paşa və Əli paşa dayandılar. Yerin sütunları silahların və minik heyvanlarının yükündən laxladı və atların nallarının zərbəsindən asimanın tavanı silkələnməyə başladı. [Yerdən qalxan] toz-torpaq fələklərin qübbəsinə çatdı. Sıx tozanaqdan havanın üzündə tutqun bir bulud, bəlkə də, digər bir zəmin peyda oldu.

Nəzm

"Yorğa yerişli toz ucbatından hava aşiqin ürəyi kimi təng oldu,
Qaniçən [döyüşçülərin vurduqları] yaralardan,
Yer cananın rüxsarı kimi qırmızı oldu".

Afrendiş öz qoşunu ilə Rum ordusunun sol cinahına ("cəvanğar"ına) həmlə edib, onları yerlərindən dəbərdərək xondgarın mərkəzinə çatdı. Erdel Ban iti qılınc zərbəsi və atəş yağdıran nizə həmləsi ilə İbrahim paşanı məğlub etdikdən sonra o da xondgarın mərkəzinə çatdı. Yeniçərilər və topçular hamısı birdən Firəng qoşununa top və tüfəng atdılar.

Beyt

"Ölülərin matəminin ardından günəş və ay,
Tüfəng tüstüsündən qara libas geydilər".

Gözə tikiş vura bilən oxlar zirehin halqasını cövşənin kisəsinə tikirdi. Ölüm tüfəngi güc-qüvvət ildırımının yara atəşi ilə savaş ərlərinin və adlı-sanlı igidlərin ciyərini yandırırdı. Döyüş meydanındakı yeniçərilərin zərbzəngləri[1946] ruh quşunu bədən qəfəsindən ruhlar aləminin fəzasına pərvazlandırırdı. Sultan Süleyman kəskin xəncəri qınından sıyırıb mərkəz qoşunu ilə düşmənə həmlə etdi.

Nəzm

"Süleymanı gör ki, necə xəncər çəkdi,
Aşağı enmiş günəşi yenidən göyə qaldırdı".

Firəng dilavərləri və döyüş meydanının şöhrətliləri sabitqədəmlik edib ox və kamana, qılınc və nizəyə əl atdılar və həmlə etdilər. Kəskin qılınc dəbilqənin başından ta zirehin ətəyinə qədər qəbanı və xəftanı qızılgül və lalə kimi [qırmızı qana] boyayaraq yarıb keçirdi. [Tökülən] qan nilufərin çöhrəsinə qırmızı söyüd rəngi verirdi və zəminin xalçasını səndəl ağacının suyundan daha əlvan edirdi.

Nəzm

"İti və parlaq qılıncdan,
Hər tərəf parça-parça olurdu.
Qılınc tutan igidlərin səyi ilə,
Qılınc və ox sürətlə şığıyırdı".

Çoxlu qırğından və savaşdan sonra küfr və zəlalət qoşunları döyüş və vuruş səfindən geri çəkilməyə başladılar, Rum ordusunun gücü və dəhşəti səbəbindən hərb meydanından qaçış biyabanına çıxdılar və yetərincə sürətlə, son dərəcə tələskənliklə qaçaraq yoxuşda və enişdə bir an belə yüyəni dartmadılar.

Nəzm

"Şikəstə silaha və qırılmış kəmərə malik idilər,
Nə əllərində taqət qalmışdı, nə başlarında səbir".

O əsnada Fərhad paşa Anadolu qoşunu ilə [düşməni] təqib edib onlara qılınc vururdu və onların damarını qoparırdı. Elə bu zaman kafirlərin sultanlarından olan birisi[1947] arxadan köməyə gəlirdi. Kafirlər zənn etdilər ki, bu, onların arxasına keçmiş Rum ordusudur və hamısı birdən pərakəndə şəkildə qaçıb dağılışdılar. Rum ordusu onları izləyib kafirlərdən bir çoxlarını qətlə yetirdi.

Nəzm

"Dəstələr kin meydanından qaçırdılar,
Onların arxasından sel kimi qan axırdı.

---

[1946] Zərbzəng – top növü.
[1947] Nüsxələrin hamısında onun adı üçün boş yer saxlanılsa da, ismi göstərilməmişdir.

Ələmin başındakı aypara toz-torpaq içinə düşmüşdü,
Elə bil ki, günəş yerin altında qərar tutmuşdu".

Rumilərin əlinə çoxlu qənimət keçdi və onlar Engirüs vilayətinin paytaxtı olan Budin[1948] şəhərinə yola düşdülər. Afrendişin oğlu bol peşkəşlərlə xondgarın yanına gəldi və şəhərlə qalanı təslim etdi. Xondgar o diyarın idarəçiliyini ona tapşırıb İslambola[1949] geri qayıtdı.

### Müxtəlif əhvalatlar

Bu il, pəncşənbə günündə, 5 şəvvalda (05.07.1527) Gözəldərə yaylağında Çuxa sultanın təhriki ilə Div sultan Rumlu öldürüldü. Onun qoşununu onun mülazimlərindən biri olan Süleyman bəy Rumluya verdilər. Çuxa sultan [təkbaşına] vəkil oldu[1950].

Bu il içində qışlaq Qəzvində baş tutdu.

## 934-CÜ İLDƏ (27.09.1528 – 14.09.1528) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Übeydin Sam mirzə ilə Hüseyn xanı Heratda mühasirə etməsi[1951]

Übeyd xan Quryan ölkəsində qışlaq edən vaxt Hüseyn xan Şamlu Heratın bürc və hasarını təmir edib darvazaları etibarlı adamlarına tapşırdı, yolları və küçələri də təmir etdirdi (möhkəmləndirdi)[1952]. Übeyd xan baharın əvvəllərində, gecə ilə gündüzün bərabərləşdiyi zamanda Heratın qala divarlarının yaxınlığında yerləşən Şadmanə[1953] kəndində öz çadırını qurdurdu. Özbək əsgərləri iki-üç dəfə döyüşə atıldılar. Amma şəhərin istehkamı və Bəhram kimi qəhredici şamluların şücaəti sayəsində onlar bir iş görə bilmədilər. Hüseyn xan və şamlu camaatı qızğın aslan və qorxunc bəbir kimi mərdlik meydanına cumurdular, xeyli şücaət göstərirdilər, çarpışma zamanı üzlərini təhlükəli bəladan çevirmirdilər, ox və nizə zərbələri ilə tükü bölürdülər. Übeyd xan [özü üçün] məlum etdi ki, Herat şəhərini döyüşlə tutmaq müyəssər deyil. O, zalım özbəkləri yollarda və keçidlərdə yerləşdirdi ki, yemək cinsindən olan heç bir şey şəhərin daxilinə aparılmasın və şəhərdə mühasirə edilmiş olanların və çarəsiz məhbusların su mənbəyinin də qarşısını alıb o diyarın rahatlıq nohurlarını zülmün toz-torpağı ilə doldurdu.

Nəql edirlər ki, gəda libasında bir şəxs şəhərin içinə bir az duz aparıbmış və daha sonra həmin libasda yenə şəhərdən çıxıbmış. Xəbislərdən biri Übeydə çatdırmış ki, bir adam şəhərin içinə duz apardı. Xanın buyruğu ilə onu bazarın başına gətirib ən qəbahətli bir şəkildə qətlə yetirmişlər.

Übeyd xan öz qoşunu və ordusu ilə birlikdə dörd ay Heratın ətrafında oturdu. O qeyrətsiz güruh hər dəfə döyüş üçün irəli gəldikdə onların çoxu yaralı, ölü, uğursuz və məyus olurdular və cürbəcür bədbəxtliklərlə[1954] geri dönürdülər. Bu əsnada Canvəfa mirzənin əmirülüməra olan oğlu Yari bəy[1955] Buxara şəhərindən gəlib çıxdı. O, Übeyd xana ərz etdi və etirazını bildirdi:

- Yerimizdə oturmaqla və küçəbəndlər uğrunda [xırda] döyüşlər aparmaqla[1956] [Heratı] fəth etmək müyəssər olmayacaqdır. [Bizə] layiq olan budur ki, bu gün aləmi yandıran ordunun hamısı birlikdə müxtəlif tərəflərdən və istiqamətlərdən döyüşə atılsın və məqsədimizi əldə edək.

Daha sonra o, bu iddianı gerçəkləşdirməkdən ötrü özbək sərdarları ilə birlikdə küçəbəndə[1957] tamaşa etmək qərarına gəldi və neçə nəfər əbləhlə birlikdə atlanıb yola çıxdı. Xeyli tamaşa etdikdən və saysız arzulara düşdükdən sonra keçməli olduğu bir yolda[1958] onun diqqətini bürcün qonşuluğunda yerləşən və dağılmış

---

[1948] Budin – Macarıstan krallığının paytaxtı. Hazırda Budapeştin bir hissəsidir.
[1949] Bakı nüsxəsi: "İstanbul".
[1950] Məclis nüsxəsi: "Çuxa sultan digər kimsənin maneəsi (müdaxiləsi) olmadan mütləq vəkil oldu".
[1951] Baroda nəşri: "Übeyd xanın darüssəltənə Heratı mühasirə etməsi haqqında söhbət". Bakı nüsxəsi: "Übeyd xanın Heratı mühasirə etməsi".
[1952] Məclis nüsxəsi: "Həmçinin bürcləri də möhkəmləndirdi".
[1953] Bakı nüsxəsi: "Şaymanə".
[1954] Baroda nəşri: "biabırçılıqla".
[1955] Baroda nəşri: "Yari xan".
[1956] Məclis nüsxəsi: "Küçəbəndlər ətrafında oturub döyüşməməklə…"
[1957] Baroda nəşri: "Baba İlahi küçəbəndinə".
[1958] Cümlənin buraya qədərki hissəsində Məclis nüsxəsində sadəcə belə yazılmışdır: "Qalaya tamaşa edərkən qəflətən..."

vəziyyətdə olan bir küçəbənd cəlb etdi. O, öz mülazimlərindən ayrılıb tamaşa üçün irəli getdi. Elə bu zaman o ərazinin qoruyucularından olan bir tüfəngçi onun tərəfə bir tüfəng [gülləsi] atdı. [Güllə] ona dəyib onu izzət atından zillət torpağına saldı. Tüfəngçi dərhal onun başını bədənindən ayırıb atını və yarağını Hüseyn xanın yanına gətirdi. Onun kisəsindən bir möhür çıxardılar və kağıza vurdular. Orada [bu sözlər] nəqş olunmuşdu: "əl-Əbd Yari bin Canvəfa mirzə". O əsnada [Yari bəyin] mülazimlərindən biri onun başına nə gəldiyini öyrənmək üçün şəhərə daxil olub, onun əhvalı haqqında məlumat alaraq geri qayıtdı.

Bu yaramazın qətli baş verən gün Damğan vilayətindən, Zinəş Bahadırın yanından bir şəxs gəlmişdi və Zeynal xanın qətli xəbərini gətirmişdi. Bu xəbərin yetişməsi səbəbindən Übeyd xana çoxlu sevinc nəsib oldu. Onun köhnə məhrəmləri deyirdilər ki, biz onu heç vaxt belə şad və xoşhal görməmişik. [Lakin] həmin günün axırında Yari öldürüldü və həmin sevinc qəmlə[1959] əvəz olundu.

Heratın mühasirəsi günləri uzanır, aclıq mərəzi yayılır, eyş karvanı yoxluq diyarına tələsirdi. Hüseyn xan, ərbablar (ağalar) və kələntərlər işin çarəsini bunda gördülər ki, ortabab adamları, şiəlikdə şöhrət tapmayanları arvadları və uşaqları ilə birlikdə, həmçinin malları və taxılları olmayan yoxsulları şəhərdən çıxarıb onların azuqəsini öz ərzaq ehtiyatlarına əlavə etsinlər[1960]. Bu işin icrası üçün sərt qaziləri təyin etdilər və onların hamısını [şəhərdən] çıxardılar. Nəticədə, Heratın içi camaatdan o şəkildə xali oldu ki, bazarda rəiyyətdən və qeyrilərindən bir kəs nəzərə gəlməz oldu. Heratın [çəki] daşı ilə bir batman duzun qiyməti üç yüz Təbriz dinarı məbləğinə yüksəlmişdi. Heratın bir batmanı Təbriz [çəkisi] ilə yarım batman və bir sir bərabərindədir[1961]. İş o yerə çatmışdı ki, xeyli nəzakətlə əllərində almaz gövhərini oynadan rifah və nemət sahibləri bir parça duzu sarıqlarının içində gizlədirdilər, xörək yeyərkən onu sarıqlarının içindən çıxarıb bir az dillərinin üstünə sürtürdülər və yeməyi bitirdikdən sonra onu yenə də gizlədirdilər.

Şeir

"Dövranın gözü şənlikdən bir nişan görmürdü,
Duz yalnız imkanlı adamların dodağına dəyirdi".

Təhlükə ilə dolu mühasirə günləri yeddi aya gəlib çatdıqda şahın bayraqlarının gəlişi xəbəri o pis yol yolçusunun (Übeyd xanın) ordusunda yayıldı. Bununla eyni anda xəbər gəldi ki, Übeyd xan tərəfindən Damğanda hakim olan Zinəş Bahadır, şah qoşununa qarşı müharibə etmiş və qətlə yetirilmişdir. Übeyd xan Herat ətrafından köç edib fərar yolunu tutdu. Dinin pənahı olan şahın yürüşü və Zinəş Bahadırın qətli bəyan qələmi ilə yazılacaqdır, inşallah.

**Zinəş Özbəyin Zeynal xan və Çəkirgə sultanla müharibə etməsinə dair söhbət**

Bu il içində Zinəş Bahadır Damğandan özbəklərin bir dəstəsi ilə Firuzkuha gəldi. O zaman Zeynal xan, Çəkirgə sultan, Mustafa sultan və sərgərdan qalmış bir dəstə adam şikar adı ilə süvar olmuşdular və gəzib dolaşmaqda idilər ki, gözlənilmədən Zinəş Bahadır özünü onlara yetirdi.

Nəzm

"Qəflətən səhradan tozanaq gəldi,
Sanki torpağın səthi yerindən qopdu.
Hamam sobasından atəşin çıxdığı kimi,
Tozanağın ardından bir güruh çıxdı.
O quldur camaatdan üç yüz nəfər irəli gəldi,
Hamısı vəhşi heyvan kimi yırtıcı və qaniçəndir.
Sürahi kimi qanlıdırlar və həramidirlər,
İnsanı xamlıqdan tutan və yerə vuran mey kimidirlər.
Mütrüb kimi cib soyandırlar və yol kəsəndirlər,
Onların [vurduqları] yaralardan hər bədən çəng kimi inləyir".

---

[1959] Məclis nüsxəsi: "bol sevinc çoxlu qəmlə..."

[1960] Məclis nüsxəsi: "...ortabab adamlar, şiəlikdə şöhrət tapmayanlar öz ailələri ilə birlikdə [şəhərdən] çıxıb getsinlər və malik olduqları taxılı və azuqəni şəhərdə qalanlara təhvil versinlər. Qazilər gecə vaxtı onların hamısını [şəhərdən] çıxardılar"

[1961] Sir – 74,24 qrama bərabərdir.

Həmin mövqedə o iki dəstə arasında böyük bir toqquşma və müharibə baş verdi. Müzəffər qazilərdən biri özünü Zinəş Bahadıra yetirib onu nizə zərbəsi ilə atdan saldı. Onun başını bədən yükündən azad etmək istəsə də, o alçağın çox həqir cüssəyə malik olduğunu görüb həmin sərgərdanın qətlindən əlini çəkdi. O halda Zinəş öz dikbaş atına mindi, şur və şərlə dolu olan özbəklər o bədbəxtin yanına cəmləşdilər. Hamısı birdən həmlə etdilər və qazilər məcburiyyət üzündən fərar vadisinə qədəm qoydular. Zeynal xan, Çəkirgə sultan və Mustafa sultan qətlə yetirildilər. Hərami Zinəş əziz-girami qazilərin başlarını Übeyd xanın yanına göndərdi, özü isə Damğana yollandı.

### İbrahim xanın öldürülməsi və Zülfüqar Türkmanın Bağdadı ələ keçirməsi haqqında söhbət

İsgəndər şanlı xaqan tərəfindən Kəlhur hakimi [təyin] edilmiş olan Zülfüqar ibn Noxud bəy ibn Gülabi bəy Mosullu Türkman[1962] bu il içində dəliliyi və cahilliyi səbəbindən dövlətsiz adamlardan ibarət bir dəstə ilə Bağdad hakimi olan əmisi İbrahim xan Mosullunun üzərinə getdi. İttifaqən, İbrahim xan Mahidəşt yaylağında[1963] idi. Hərçənd mülazimlər Zülfüqarın xeyli qoşunla oraya doğru sürətlə yürüməkdə olduğunu xana ərz etsələr də, [xan bu fikri] qəbul etmədi[1964]. [İbrahim xan] mülazimlərdən beş-altı nəfərlə[1965] birlikdə divanxanada oturmuşdu ki, o əsnada avara Zülfüqar hərəsi bir yerdən gəlib başına toplanmış olan iki yüz nəfər şər adamla xanın ordugahına çatdı. Hamısı birdən at çapdılar (basqın etdilər). İbrahim xan canının qorxusundan özünü hərəmxanaya saldı. Zülfüqar piyada olub alaçığın kəndirini qılıncla kəsdi. Alaçıq İbrahim xanın başına yıxıldı. Zülfüqar kəskin qılınc zərbəsi ilə İbrahim xanı və onun beş-altı mülazimini parça-parça etdi. Xanın əksər nökərləri Zülfüqara tabe oldular[1966]. Həmin zaman Seyid Məhəmməd Kəmunənin[1967] oğlu Seyid bəy dörd yüz süvari ilə gəlib çatdı və məcburiyyət üzündən Zülfüqara qoşularaq o bədbəxtin nəzərdiqqətini özünə cəlb etdi. Zülfüqar öz mülazimlərindən bir çoxlarına buyurdu ki, qaşlarını və saqqallarını[1968] qırxsınlar. [Daha sonra] oradan Bağdada gəldi. Mühasirə nəticəsində oranı ələ keçirdi, özünün bütün qohumlarını öldürdü və tamam İraqi-Ərəbin valisinə çevrildi.

Nəzm

“Bağdaddan gəldi bir elçi,
Ağıllı və azadə bir adam idi.
[Dedi] ki, dövran sitəm yoluna çıxdı,
Yaxşının və pisin üzünə fitnə qapısını açdı.
Fələk yeni bir gərdiş etməyə başladı,
Cahanda başqa bir qayda-qanun peyda oldu.
Zülfüqar hakimlik kəmərini belinə bağlayıb,
Fəsad və döyüş qapısını açıq qoyub.
Beyni qeyri-mümkün fikirlərdən pərişandır,
Xəyalında hökmranlıqdan başqa bir şey yoxdur”.

## 935-Cİ İLDƏ (15.09.1528 – 04.09.1529) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Cam mövqeyində özbək xanları ilə müharibə etməsi

Dinin pənahı olan şah Xərrəqan yaylağında günlərini fərəh və sevinclə keçirdiyi zaman bir-birinin ardınca Xorasan tərəfdən qasidlər gəlməyə başladılar və ərz etdilər ki, Übeyd xan düşmənçilik bayrağını qaldırmış, yenidən o diyarda fitnə-fəsad atəşini şölələndirmiş, pis qaydalar və qondarma qanunlar ortaya atmış, hamıdan öz əclaf nəfsinə tabe olmağı tələb etmiş, məzəmmət doğuran adətlərinə, alçaq xasiyyətinə, daş və dəmirçi zindanı kimi sərtləşmiş ürəyinə və kobud düşüncəsinə uyğun rəftar edərək vəfa niqabını və həya pər-

---

[1962] Baroda nəşri və Bakı nüsxəsi: “Kəlhur hakimi olan Zülfüqar ibn Noxud sultan”.
[1963] Mahidəşt yaylağı – Kirmanşahdan qərbdə yerləşir *(Seddon, şərhlər, s.259).*
[1964] Məclis nüsxəsi: “İbrahim xanın vəkilləri və vəzirləri ərz etdilər ki, Zülfüqar sənin qəsdinə durub”.
[1965] Məclis nüsxəsi: “on-on iki nəfərlə”.
[1966] Məclis nüsxəsi: “[Öldürülənlərin] əksəri əyanlar idilər. Xanın mülazimlərinin çoxu isə Zülfüqarla əlbir idi”.
[1967] Baroda nəşri: “Kəmunə” əvəzinə səhvən “Məkunə” yazılmışdır.
[1968] Məclis nüsxəsi: “öz mühiblərinin saqqallarını qırxdırdı”.

dəsini atmış, həmişəlik bağlanmış olan zülm və haqsızlıq yolunu açmış, rahatlıq o diyarda Ənqa quşu kimi yox olmuş, rifah qırmızı kükürd kimi tapılmaz olmuş, sənət əhlinin bazarı yatmış, xalqın əksəri evlərini və əhlü-əyallarını atıb fərar etmiş və bir çoxları işgəncə yarasından həlak olmuşlar.

Nəzm

“Dırnaqdan baş qaldırmışdı qan qönçəsi,
İşgəncədən bədən əzab içinə düşmüşdü.
İnsanların əlləri meşədəki sərv kimi boş qalmışdı,
Başları isə zərb olunmuş sikkə kimi zərbə yemişdi.
Kərəm əhli kimi mədrəsələrdən də əsər qalmamışdı,
Qəzavü-qədərin əli kimi ləyaqət də üzüqara idi”.

Elə ki bu əhvalatların şərhi hökmdarın qulağına çatdı, padşahanə qeyrət atəşi şölələndi. [Şahın] ali rəyi belə lazım buyurdu ki, qalibiyyətli qoşun Xorasana irəliləsin və qürur şərabından sərxoş olanları cəzalandırsın. Hökmdarın bu barədə fərmanı verildi ki, təvaçılar məmləkətlərin [ayrı-ayrı] hissələrinə və vilayətlərin nahiyələrinə adamlar çapdırıb qəhrəman əsgərlərin orduda hazır olmaları haqqında car çəkdirsinlər.

Nəzm

“Hər tərəfə uçaraq gedən at çapdırdılar,
Onlar oxun kamandan atıldığı sürətlə gedirdilər.
Fərman tabeçilərə çatdığı anda,
Yürüşün hay-küyü Keyvana çatdı.
Hər səmtdən sanki coşqun bir Dəclə təlatümə gəldi,
Və o, döyüş okeanına doğru axmağa başladı”.

Fələyin hadisələri qədər nəhayətsiz və günəşin zərrələri kimi həddən artıq böyük bir qoşun və ucsuz-bucaqsız bir ordu qələbə ayətli bayraqların kölgəsində cəmləşdi. [Dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin padşahı Cəmşid qaydasında və Fəridun ayinində Qəzvindən Xorasana tərəf hərəkətə gəldi və ramazanın (09.05. – 09.06.1529) əvvəllərində uğur və səadətin müşayiəti ilə Məxur çəməninə[1969] cah-calalla gəlib yetişdi.

Dodaqlarını bağlayanlar (oruc tutanlar) bayram hilalını barmaqla göstərdiyi bir vaxtda o həzrət Sarıqamışa çatdı, o məqamda fərəhli[1970] bir şəkildə Orucluq bayramının qeyd edilməsi ilə məşğul oldu və iki-üç gün şadlıq, şənlik, eyş və istirahətlə keçirdi.

“Sultan meydanı”nın zahiri məkanı fələyə ucalan çadırların qurulduğu və səmanı bürüyən zəfər naxışlı bayraqların vurulduğu yer oldu. Elə bu vaxt xəbər gəldi ki, Übeyd xanın igidlik meydanının öndəgedənləri və mübarizə gününün seçilmişləri[1971] olan dikbaş bahadırlardan bir dəstəsi ilə Zinəş xan Damğan qalasının möhkəmliyinə və mətinliyinə güvənib qürur və təmkinlə [orada] oturmuş və öz [ağlında] batil xəyallara və səmərəsiz təsəvvürlərə yol vermişdir. [Şah tərəfindən] ali əmr verildi ki, Çuxa sultan, Üləmə sultan və Məhəmməd xan Zülqədəroğlu[1972] cəsurluq yolunun yolçularından ibarət bir dəstə ilə Damğan tərəfə sürətlə yürüsünlər və Zinəşi bəla torunun əsirinə çevirsinlər. Onlar göstərişə uyğun olaraq, təcrübəli dilavərlərlə birlikdə bu mühüm əmrə tam sədaqət və qəti etimadla “baş üstə!” deyib yola düşdülər. Hökmdarın məiyyəti mərəkə tozunu səadət gözünün tutiyası bilən, həyat suyunu döyüşün zülmətində axtaran, mizrağın müşk ətirli türrəsini gözəllərin ənbər qoxulu zülfündən üstün tutan, iti nizənin zərbəsi ilə, qaniçən və ildırım kimi işləyən polad qılıncın yarası ilə damar yükünü külbaş düşmənlərin canından çıxaran, kamanın ox yağışı nəticəsində bədənlərində yaranan yaraları yaşıl başlı dağların qoynunda bitən güllərə bənzədən və döyüş meydanında polad kimi bişib bərkimiş olan dilavərlərlə birlikdə əmirlərin arxasınca yollandı.

Şeir

“Hər birisi polad üzlü balta kimi idilər,
Qan tökməkdə hamısı şöhrətli qılınc kimi idilər.

[1969] Məxur çəməni – Rey bölgəsindəki Savuxbulağ yaxınlığındadır *(Seddon, şərhlər, s.259).*
[1970] Baroda nəşri: “uğurlu”.
[1971] Məclis nüsxəsi: “Übeyd xanın mübarizlərinin öndəgedənləri”.
[1972] Baroda nəşrində səhvən “Zülfüqaroğlu” yazılmışdır.

Hamısı sərvər idi, düşməni döyən gürz kimi,
Hamısı səf yaran idi, yara vuran nizə kimi.
Bazuları iş görən vaxt möhkəm kaman kimi idi,
Döyüş meydanında isə ağır toppuz kimi idi.
Mizraq kimi sərbəsər qan tökmək qəsdində idilər,
Kəmənd atıb bir-bir düşmənin boynuna dolardılar.
Hamısı sərdardır, dəbilqə kimi dəmir ürəklidir,
Hamısı bəktər kimi sərt bədənlidir və döyüşkəndir.
Zireh geyib bir-birinin arxasınca döyüşə atıldılar,
Üzlərini sipər kimi düşmənə tutmuşdular.
Həngamədə və qovğada gərənay kimi nərə çəkirdilər,
Bayraq kimi başları yuxarı, ayaq kimi yerdə möhkəm idilər".

Çuxa sultan bir dəstə bahadırla asimandan gəlmiş qəza və gözlənilməz bir bəla kimi Damğan ətrafında okeana çevrildi (oranı mühasirəyə aldı). Nağara vurdular və şeypur çaldılar. Kurkənin və borğunun sədasından, kosun nəriltisindən və nəfirin hay-küyündən o güruhun (özbəklərin) vəlvələ dağına zəlzələ düşdü. [Qızılbaş] qoşununun çoxluğundan çöl və səhra daraldı. Bu vəziyyəti müşahidə edən Zinəşin içinə ataş düşdü, başından heyrət tüstüsü çıxdı. Onun səbat ayağı yerindən dəbərdi və xeyli məşəqqətlə özünü qalanın içinə saldı. Əmirlər, dövlət ərkanı və Mərrix kimi qızğın əsgərlər qalanı mərkəz kimi araya aldılar. Ustad Şeyxi Topçu bir dəstə tüfəngçi ilə [qala] hasarından hündür olan bir çinar ağacının üzərində mövqe seçib düşmənləri tüfəng [atəşinə] tutdu. Hər an ölüm ahəngli tüfəng gülləsi "De ki, [qarşısından] qaçdığınız ölüm sizi mütləq yaxalayacaqdır"[1973] [ayəsinin] xəbərlərini onların ürəyinə yetişdirirdi. Hər dəm şiddətli intiqam alan qılıncın iti dilli xətibi "Harada olursunuz olun, hətta uca [möhkəm] qalalar içərisində olsanız belə, ölüm sizi haqlayacaq"[1974] [ayəsinin] bəlağətli xütbəsini onların qulağına oxuyurdu. Hərçənd özbəklər məğlubiyyət dənizindən qurtulub bir yerə sığınmaq istəsələr də, qarşılarına cəhənnəmdən savayı heç nə çıxmırdı. Hansı tərəfə səy edirdilərsə, "Siz kafirləri şiddətli əzabdan kim qurtara bilər?!"[1975] sədasından başqa heç nə eşitmirdilər. Zinəş bəzən [mühasirədən] çıxmaq üçün azğın özbəklərin bir dəstəsi ilə bir guşədən basqın edirdi və öz bahadırlarından neçə nəfəri ölümə verirdi. Hər nə qədər gözəllərin qəmzəsi kimi qılınc çəksə də, dilbərlərin zülfünün ucu kimi şikəstə və pərişan gəzməkdən başqa bir iş görə bilmirdi. Hansı tərəfə üz tuturdusa, qurtuluş yolunu bağlı görürdü. Ürəyində "xilas" deyə fəryad edirdi. Bir gecə o, belinə kəndir bağlayıb, aradan çıxmaq üçün qaladan aşağı endi. Qazilər [bundan] xəbər tutdular və onu ələ keçirib həyat şöləsini qılıncın suyu ilə söndürdülər. Qələbə şüarlı ordu bir həmlədə qalanı tutdu. Qəti dəlil və aydın fərman ilə iti qılınc "Allah malları və canları ilə cihad edənləri üstün qılmışdır"[1976] [ayəsini] onlara oxudu. Özbəklərin hamısını qətlə yetirdilər. Zinəşin qətlinin və Rüstəm misallı padşahın yürüşünün xəbəri Übeydə çatdı.

Nəzm

"Xan xəbər tutdu ki, xaqan gəlib,
Xorasan mülkünün zəbti üçün özünü yetirib.
O, Rüstəm sifətli ordudan qorxdu,
Heratdan Səmərqəndə tərəf üz qoydu".

[Übeyd xanın] ürəyini tamam xof bürüdü. O, Heratın ətrafından köç etdi, qanla dolu ürəklə Ceyhundan keçdi və Mavəraünnəhr sultanlarının ətəyindən yapışıb mədəd və kömək dilədi.

Dinin pənahı olan şah Damğana yollandı. Kalpuş mövqeyi coşqun və hay-küylü ordunun mənzil yeri olduqda xəbər çatdı ki, Qənbər Əli bir dəstə özbəklə İsfərayində oturmuşdur və sitəm qapılarını o bölgənin rəiyyətinin üzünə açmışdır. O həzrət (Şah Təhmasib) Çuxa sultanı, Həmzə sultanı və Hüseyn sultanı bir dəstə qazi ilə onları dəf etməyə göndərdi. Əmirlərin gəlişi barədə xəbər alan Qənbər Əli ildırım və külək kimi Mavəraünnəhrə tələsdi. Yüksək şanlı əmirlər dərya kimi coşan bir qoşunla Xəbuşan qəsəbəsinədək onların ar-

---

*[1973] Qurani-Kərim, "Cümə" surəsi, 8-ci ayə.*
*[1974] Qurani-Kərim, "Nisa" surəsi, 78-ci ayə.*
*[1975] Qurani-Kərim, "Mülk" surəsi, 28-ci ayə.*
*[1976] Qurani-Kərim, "Nisa" surəsi, 95-ci ayə.*

dınca getdilər və daha sonra geri dönüb orduya qoşuldular. Zəfərin nəsib olduğu məiyyət ay və günəş kimi mənzilləri və mərhələləri qət etdi.

Nəzm

“Acizlərə nəvaziş göstərən sultan yol getdi,
Hicaz karvanından daha salamat getdi.
Onun ulduzların sayı qədər olan məiyyəti,
Himmətdən başqa rəiyyətdən heç bir mədəd ummadı”.

[Şah ordusu] müqəddəs Məşhəddə dayandı. Səkkizinci imam və yeddinci qiblə olan İmam Rzanın – ona salavat və salam olsun – ziyarətindən sonra Cama yollandılar. Günəş şəfəqli bayraqlar səadət kölgəsini Xərgərdə[1977] saldılar. O məqamda zəfər aqibətli qoşunların qaravulları gəlib ərz etdilər ki, özbək xanları bu yaxınlıqda yerləşmişlər. O həzrət (Şah Təhmasib) qorçulardan on dörd nəfəri “dil” tutmağa göndərdi. O tərəfdən də dörd yüz [özbək] süvarisi həmin iş üçün [irəli] gəlmişdi. Qazilər onlarla rastlaşıb bir neçə nəfəri ələ keçirdilər.

Ertəsi gün dinin pənahı olan şah, Üləmə sultanı və Zülqədəroğlu Məhəmməd xanı göndərdi ki, düşməndən dürüst xəbər gətirsinlər. Onlar özbək xanları ilə qarşılaşdılar, [lakin] döyüşməkdə fayda görməyib geri qayıtdılar.

Səhəri gün özbək sultanları Zirabad keçidində[1978] mövqe tutdular. Bu yer fələk şövkətli ordunun [yerləşdiyi məkandan] daha hündürdə idi. Hər iki tərəfdə tonqallar qalandı və gözətçilər təyin edildi. Sübh vaxtı günəşin doğması ilə qaranlıq ortadan getdi, cahan fəzası gecə zəncisinin zühurunun zülmətindən pak oldu.

Nəzm

“Səhər vaxtı gündüzün sultanı günəş,
Kin qılıncının məşəlindən çıxıb evləri odladı.
Onun şölələnən atəşi elə bülənd oldu ki,
Ülkər [ulduzu] üzərliyin düyünləri kimi yandı.
Gecənin div çöhrəli ordusunun qəsdi ilə,
Göydəki günəşin zərrələri qılınca döndü”.

Dinin pənahı və Allahın kölgəsi olan şah zəfər dəbilqəsini başına qoyub müsəlləh və mükəmməl oldu.

Nəzm

“Cahan hökmdarı zireh geyindi,
Polad cövhər altında nihan oldu.
Günəş misallı, zəfər nişanlı qılıncı kəmərindədir,
Əcəl ona xidmət üçün belinə kəmər bağlayıb.
Nizə çəkib fitnə salan kəslərin,
Şükür olsun ki, qanını axıtdı”.

[Şah Təhmasib] gecə xəyal dəstəsindən qurtulmuş və gündüz şimal yelini ötmüş tünd xasiyyətli gözəl atına mindi.

Şeir

“Fələyi gəzən bir atdır, ildırım kimi,
Cahangirdir, günəşin işığı kimi.
Nəzər oxundan itidir yerişi,
Səhər küləyindən daha sürətlidir.
Getməkdə buluda bənzər, oynamaqda şimşəyə,
Bir anda qərbdən gələr, şərqə gedər.
Davranışları hər cəhətdən nazlı-qəmzəlidir,

---

[1977] Xərgərd – Türbəti-Cam şəhərindən cənub-qərb tərəfdə yerləşir. Xəvaf şəhristanına daxildir.

[1978] Bakı nüsxəsi: “Zurabad qəsəbəsi”. Xorasanda, Səbzəvardan şimalda yerləşən Cüveyn bölgəsində həm Zirabad, həm də Zurabad adlı kənd var. Bu iki kənd bir-birinin yaxınlığında yerləşir.

Yürüş vaxtı mükəmməl yerişlidir.
Qaçışda ahulardan daha qabaqdadır,
Qızğınlıqda atəş kimi, incəlikdə su kimidir.
Əgər o tünd gülgün rəngli ata "hey" desən,
Altı cəhətin hər birinə addım atar.
Onun belinə mindi görkəmli bir insan,
Sanki badi-sərsərə süvar oldu Süleyman".

[Şah Təhmasib] ölkə tutan ordunun tərtibi ilə məşğul oldu. Çuxa sultan Təkəlü, Hüseyn xan Şamlu, Təbərrük xan Şamlu, Həmzə sultan Zülqədər[1979], Həmzə sultan Təkəlü, Əhməd sultan Ustaclu, Əhməd sultan Əfşar, Məhəmməd xan Zülqədəroğlu, Pirqulu sultan Şamlu, Yaqub sultan Qacar, Məhəmməd sultan[1980] Şərəfəddinoğlu, Həsən Durğudoğlu[1981] və Məlik bəy Xoyi[1982] bəziləri sağ cinahda və bəziləri sol cinahda qərar tutdular. Firəngi zərbzənlərin yükləndiyi arabalar ordu səfi önündə yerləşdirildilər. Qızılbaş qoşunu günəş zərrələri kimi saysız və bulud qətrələri miqdarınca çoxlu idi. Hamısı aslan kimi qüvvətli, fil kimi əzəmətli, şir və bəbir kimi daş ürəkli və dəmir pəncəli, pələng və qurd kimi iti caynaqlı idi.

Nəzm

"Hamısı canavardan doğulmuş, yırtıcı təbiətlidir[1983],
Vəhşi nəriltili aslanlardan daha qapağandırlar.
Hamısı tez hirslənən, gec soyuyandır,
Elə təsəvvür et ki, qəzəbdən yoğrulmuşlar".

Übeyd xan və Kuçum xan da öz ordularını düzdülər.

Nəzm

"Digər tərəfdən cəsur özbəklər,
Çatdılar nərildəyən aslan kimi.
Hamısı yaşıl gözlü, sarı üzlüdür,
Sanki kəhrəbaya lacivərd oturmuşdur.
Qıvrım-qıvrımdır bol tüklü qaşları,
Gözləri qaşlarının altında gizlənmişdir.
Çöhrələrinin səhifəsi xətdən (tükdən) xalidir,
Çənələri saqqal kimi uzundur.
Hamısı bayquş gözlü, hamısı div üzlüdür,
Hamısı [dar] gözlüdür, hamısı bəd üzlüdür.
Heç birinin üzündə tük yoxdur,
O üzdə bədbəxtlik tozundan başqa şey yoxdur.
Başları balqabaq kimi tüksüzdür,
Üzləri qalxan kimi qırış-qırışdır.
Çənələri başdan-ayağa qədər uzanır,
Hamısı saqqalsız qocalar kimi xoşagəlməzdirlər".

Übeyd xan tamam Mavəraünnəhr, Kaşğar, Türküstan, Əndican, Otrar, Seyran[1984], Qamil[1985], Turfan[1986], Qəlmaq və Qazax məmləkətlərindən, Dəşti-Qıpçaqdan və Qırğızdan saysız qoşun toplamışdı. Belə ki, Çingiz xanın ortaya çıxışından ta bu zamana qədər bu çoxluqda qoşun Amudərya çayını keçməmişdi.

Nəzm

"Qarışqadan daha ziyadə, çəyirtkədən daha çox idilər,

---

[1979] Bakı nüsxəsi: "Həmzə sultan Şamlu".
[1980] Bakı nüsxəsi: "xan".
[1981] Məclis nüsxəsi: "Həsən sultan Zülqədəroğlu". Bakı nüsxəsi: "Həsən sultan Durğudoğlu".
[1982] Baroda nəşri: "tündxasiyyət Məlik bəy".
[1983] Özü də bir qızılbaş türk döyüşçüsü olan Həsən bəy Rumlu qızılbaşların canavardan (qurddan) doğulduğunu bildirməklə əski türk inanclarındakı bozqurd əfsanəsinə işarə etmişdir.
[1984] Seyran – Qazaxıstanın Türküstan (Yəsi) şəhəri yaxınlığında lokalizə edilir *(Seddon, şərhlər, s.241)*.
[1985] Məclis nüsxəsi və Baroda nəşri: "Qabil".
[1986] Turfan – Şərqi Türküstanda şəhər (hal-hazırda Çinin tərkibindədir).

Bütün dağı, çölü və yamacı bürümüşdülər".

Übeyd xanla Kuçum xan mərkəzdə qərar tutdular. Sol cinahda Büraq xanı, Fulad sultanı, Əbdüləziz sultanı və Əbdüllətif sultanı yerləşdirdilər. Sağ cinaha isə Canibəy sultanı, Gildi Məhəmməd sultanı və Əbu-Səid sultanı təyin etdilər. Sevincək Məhəmməd sultanı Qənbər Əli bəy, Şeyx Dərviş bəy və Rüstəmqulu bəy ilə ittifaqda ehtiyatda qoydular. Təbil Xoca ilə Qaraca Bahadırı qaravul təyin etdilər. Hər biri bir Rüstəm olan Kəskən Qara sultan, Qəməş-oğlan, Təniş bəy[1987], Seydim mirzə, Cağatay Bahadır, Bayaqu Bahadır, Hafiz Qünqürat, Şeyx Əbu-Səid Əfrasiyab kimi digər sultanlar və əmirlər öz yerlərində qərar tutdular. Hər iki tərəfdən nağara və nəfir sədaları, döyüş meydanındakı bahadırların şeypur avazı səmaya yüksəldi.

Nəzm

"Qiyamət təbiətli nəfirin sədasından,
Cahan giriftar oldu axırzaman tufanına.
Fitnə nağarasına çubuq toxundu,
Nağara əlini başına vurdu, dad-fəryad etdi".

Hər iki qoşun Əxzər dənizi (Atlantik okeanı) kimi dalğalanmağa başlayıb bir-birinə həmlə etdilər. Aslan ürəkli kişilər və səf yaran pəhləvanlar bir-birinə cumdular. Elə bir döyüş baş verdi ki, atların tapdağının şiddətindən və təmasından torpaq havaya qalxdı və minik heyvanlarının nallarından o qədər toz-torpaq yüksəldi ki, cahanı işıqlandıran günəş tozanaq niqabı içində örtülü qalıb çöhrəsini açmadı.

Nəzm

"Çərxi-fələyin üzərinə o qədər toz oturdu ki,
Orada torpaqdan bir bürc peyda oldu.
O meydanda ordunun tozanağından,
İldırım sərsəm olub öz yolunu itirdi".

Döyüş meydanının tozanağının ortasındakı qılınc, qara bulud arasındakı ildırım parıltısını xatırladırdı. Mübarizlərin əlindəki nizənin dili deşici şimşəkdən söhbət açırdı. Oxlar çəyirtkə ordusu kimi səhranın fəzasını qaraltmış, sürmə niqabını günəşin rüxsarına çəkmişdi. İti peykanlar nəsihətçilərin öyüdləri kimi döyüşçülərin ürəyinə otururdu.

Nəzm

"Sürətli xədəng nəzərdən gizli şəkildə,
Əcəl oxu kimi özünü qəflətən yetirdi.
Nizələr bədən sarayına elə zərbə vurdu ki,
Bu zərbədən həmin bina yerə çökdü.
Fələyi doğraya bilən qılınc kimi iti nizələr,
Savaş meydanında ox kimi uçuşurdu.
Tüfəng əjdaha kimi idi, başı qəhrlə dolu idi,
Ağzı atəşlə dolu idi, içi zəhərlə dolu idi".

Qiyamət əlamətli qızılbaş qoşunu bəndəlik kəmərini bağlayıb igidliyin sərsəri küləyi ilə savaş atəşini şöləndirdi. İldırım qüvvətli özbək əsgərləri ölüm ahəngli xədəngin peykanı ilə Sürəyyanı Cövza kəmərinə tikirdilər. O əsnada Canibəy sultan özbəklərin bir dəstəsi ilə mətanət ayağını önə qoyub təkəlü əmirlərinə həmlə etdi. Çarpışma zamanı qızılbaş əmirləri məğlubiyyətə düçar oldular. Bu zaman igidlik yolunun yolçusu olan Məhəmməd sultan Şərəfəddinoğlu atdan yıxıldı. Mülazimlərdən biri onu [ata] mindirdi və Həsən sultan Durğudoğlu[1988] onun köməyinə çatıb döyüşməklə məşğul oldu. Axırda təkəlü əmirləri fərar etdilər. Canibəy sultan onları qarşısından kənarlaşdırıb qələbə şüarlı ordunun arxasına həmlə etdi. [Özbəklər] ordubazarın qatırlarını oxa tutaraq onları yaraladılar və öldürdülər.

Nəzm

"Dəvə bədəninə bəs qədər ləlƏkli ox yediyi üçün,
Oxun lələkləri ucbatından hər bir dəvə dəvəquşuna döndü.
Peykanlardan onu gicişmə tutdu,

[1987] Məclis nüsxəsi: "Qəmiş sultan, Təlmiş bəy". Bakı nüsxəsi: "Qəməş-oğlan, Tənəş bəy".
[1988] Məclis nüsxəsi: "Zülqədəroğlu".

Dəvə durna kimi havaya uçdu".

*İgid ordubazarçılar özbəkləri ox zərbəsi ilə özlərindən uzaqlaşdırmağa çalışsalar da, özbəklər qələbə qazanıb əksər ordubazarçıları yaraladılar və öldürdülər*[1989].

Sol cinah əmirləri də fərar etdilər. Belə ki, Yaqub sultan Qacar[1990] və Məlik bəy Xoyi ta Damğana və Simnanadək heç yerdə dayanmadılar. [Hətta] sol cinahın fərar etməsindən sonra da dinin pənahı olan şah bir qütb kimi öz məqamında qərar tutdu və qətiyyən öz xatirində bir dəyişikliyə yol vermədi.

Nəzm

"Şah xas adamları ilə ordunun qəlbində dayanmışdı,
Qəddi sərvə bənzəyirdi, üzü tər gül ləçəyi kimi idi.
Qəlbinin parlaqlığından cəbbəsi səmadakı ay kimi idi,
Həmin ay fitnə-fəsadı ondan kənarlaşdırırdı.
Onun qılıncı cövhərdardı, qəzəbdən qırışmışdı alnı,
Cövhərsiz düşmənin həsəddən ciyəri qan olmuşdu".

Özbəklər qarşıdan gəlmədikləri üçün[1991] səfin qabağında dayanmış topçular və tüfəngçilər atəş açmaqdan əl çəkib öz yerlərində dayandılar. Tozanaq zülməti o səviyyəyə çatdı ki, o məclisdə dostla düşməni ayırmaq çətinliklə müyəssər oldu.

Nəzm

"Atların tozanağından hava qaraldı,
Bir qara bulud göylərə bülənd oldu.
Fələyin üzü yetərincə tozla doldu,
Ağırlaşdı, düşdü torpaq üstünə".

Bir müddət sonra havanın qaranlığı aradan qalxdı və aydınlıq zahir oldu. Bu zaman ətrafında bir dəstə adamın dayandığı bir ağ bayraq dinin pənahı olan şahın nəzərinə tuş gəldi. O həzrətə bəlli oldu ki, Übeyd xan həmin bayrağın altındadır. Dinin pənahı olan şah ordunu o üzüqaranı dəf etməyə göndərdi. Dövlətsevər qazilərin və davakar qorçuların hamısı qılınclarını çəkib Übeydlə Kuçumun üzərinə cumdular.

Nəzm

"O dargözlərə qılınc vurdular,
Onların canına aman vermədilər.
Baş kəsmək elə adiləşdi ki,
Sanki meydan turpla doldu".

Übeyd xanla Kuçum xanın ordusu da müdafiə olunmağa başladı. Dövrün şahidi qılınc sayəsində zülmani niqabı nurani çöhrədən açdı və ürəksizlərin canının qəsdi üçün cilvələnməyə başladı. Kaman öz arxasını bədgüman düşmənə çevirib sürətli ox qasidinin müşayiəti ilə qaçılmaz [ölüm] hadisəsinin xəbərini böyüklərin və kiçiklərin ürək ölkəsinə yollayırdı. Elə ki döyüş meydanı qorçuların atəş yağdıran qılıncı ilə istiləşdi, murad küləyi qazilərin bayrağına tərəf səadətlə əsdi və qələbə qoxusu möhtərəm dilavərlərin burnuna dəydi, Übeyd xanla Kuçum xan müharibə meydanından üz çevirib qaçış yolunu tutdular.

Nəzm

"Şah meydanından fərar etdi Übeyd,
O, şahın cövlanından ov heyvanı tərzində qaçdı.
Dikbaş xanlar sərsəm bir halda,
Hamısı birdən qaçmağa üz qoydular".

Nəql olunur ki, qızılbaş qoşununun fərar etdiyi əsnada özbək sərdarları və Səfəviyyə xanədanının düşmənləri Übeyd xanın yanına gəlib fəth və zəfər müjdəsini ona yetirmişdilər. O zaman sözügedən şəxs (Übeyd xan) demişdi:

---

[1989] Bakı nüsxəsi (125a).
[1990] Məclis nüsxəsi: "Yaqubcan".
[1991] Məclis nüsxəsi: "Özbəklər qarşıda dayanmadıqları üçün".

- Uzaqdan bir qaraltı görürəm; bir müddətdir ki, yerinə dayanıb və hərəkətə gəlmir. Deyəsən, onlar qızılbaş ordusunun qılıncdan qurtulmuşlarıdır ki, o yerdə dayanıblar. Gərəkdir ki, bir dəstə gedib onlardan bir xəbər gətirsin və vəziyyət barədə həqiqəti ərz etsin.

[Übeyd xanın] yaxınlarından bəziləri dedilər:

- Qızılbaşlara elə bir məğlubiyyət yol tapıb ki, onların bu məkanda qalması mümkün deyildir. Yəqin, bunlar o qoşunun adamlarının dördayaqlılarıdır (heyvanlarıdır) ki, orada dayanmışlar.

Übeyd xan bu sözü qəbul etməyib dedi:

- Bu, ordu qaraltısıdır, heyvan qaraltısı deyildir.

Nəhayət, sipahilərdən bir neçə nəfər o qaraltını təhqiq etməyə getdi. Həmin qaraltı hərəkətə gəldi. Təhqiqə gedən adamlar bildilər ki, bu, qoşundur və dərhal geri qayıdıb vəziyyət barədə həqiqəti ərz etdilər. Elə bu zaman şamlu və zülqədər qorçuları və digər müzəffər əsgərlər döyüş meydanına atıldılar. Übeyd xan bol-bol kədərlə idbar üzünü fərar vadisinə çevirdi. Şah qorçularından biri o rəzalət yolunun yolçusuna çatıb ona arxadan bir qılınc vurdu, [lakin] cüssəsi çox həqir olduğu üçün ondan əl çəkdi. Übeyd xan o cavanın zərbəsindən özündən getdi. Yaxınlarından[1992] biri onun cilovunu tutdu və digəri onun arxasına minib atını çapdı. O halda başqa bir qorçu özünü ona yetirib o natamamın işini tamama yetirmək istədi. Amma Təbil Xoca Əmiraxur ox zərbəsi ilə o qorçunun iddiasını geri çevirdi. Übeyd xanla Kuçum xan çoxlu məşəqqətlə o təhlükəli yerdən xilas oldular. Düşmən qoşunu hər nəfərin müqabilində iyirmi nəfər say çoxluğuna malik olmasına baxmayaraq, məğlubiyyətə uğradı və “Sizin səbirli iyirmi adamınız onların iki yüz adamını məğlub edər”[1993] [ayəsinin] məzmunu zühur etdi.

Nəzm

“O müzəffər cəngavər azsaylı qoşunla,
Möhtəşəm bir ordunu məğlub etdi”.

Elə ki yaramaz özbəklərin təkəbbür və lovğalıq zirvəsinə qalxmış şövkət və iqtidar bayrağı uğurlu taleyin gücü ilə aşağı endi, dinin pənahı olan şah döyüşkən qorçularla birlikdə fələk yerişli atından yerə enib istirahət etməyə başladı.

Nəzm

“Fələyin qulam olduğu bu şah qaranlıq gecədə,
İti yerişli atından aşağı endi.
Atından yerə endi cahanın şahı,
Sankı Məsih asimandan yerə endi.
Ulduzlardan göy üzündə məşəllər yandı,
Qaranlıq gecə, gündüzdən daha işıqlı oldu”.

Tünd xasiyyətli qazilər və döyüşkən dilavərlər onu (şahı) əhatə etdilər. Qızılbaşların ardınca malları ələ keçirməyə və onları qətl etməyə getmiş Canibəy sultan bir çox özbəklərlə birlikdə həmin vaxt gəlib qələbə şüarlı ordunun yanında dayandı. Onlar elə bilirdilər ki, bu, Übeyd xanın ordusudur və şah öz ordusu ilə döyüş meydanından qaçmışdır. Dinin pənahı olan şah və dövlətsevər sərdarlar gördülər ki, böyük bir qoşun xofsuz və qorxusuz gəlib onların yanında dayandı. Əzəmətli qazilər kəşfiyyata getdilər. Çoxsaylı qazilər özbəklərdən iki nəfəri tutub dinin pənahı olan şahın yanına gətirdilər. Əsirlər vəziyyət barədə həqiqəti bəyan etdilər. Fələyin qulamlıq etdiyi padşah gözəl yerişli atına süvar olub onların üzərinə yollandı. Çuxa sultan son dərəcə namərdliyi üzündən dizini yerə qoyub dedi ki, fərar etmiş qazilərin gəlib bizə qoşulması üçün bir az gözləmək lazımdır. Lakin onun bu söhbəti o həzrətin (şahın) doğru fikirli ağlına xoş gəlmədi və [şah] yola düşdü. Übeyd xanın qoşununun məğlubiyyəti Canibəy sultana aydın olduqda o, məcburiyyət üzündən fərar etdi. Sayları ulduz qədər olan və mələklərdən yardım alan qoşunlar (qızılbaşlar) onları (özbəkləri) təqib edib bir çoxlarını qətlə yetirdilər. Özbəklər elə çaş-baş olmuşdular ki, atlarını qoyub, dəvələrinə minərək fərar edirdilər.

Beyt

“Sənin qələbənin həsədindən düşmən özünü itirib,

---

[1992] Məclis nüsxəsi: “Özbəklərdən”.
[1993] *Qurani-Kərim, “Ənfal” surəsi, 65-ci ayə.*

Onlar yeni ay gələrkən yox olan köhnə ay kimi qaçıblar".

Nadir təsadüflərdən biri odur ki, Übeyd xan Mavəraünnəhr üləmasından qırx nəfəri özü ilə gətirmişdi. Məqsədi bu idi ki, onlar savaş günündə dua etsinlər və onların duası vasitəsilə qızılbaş ordusuna qalib gəlsin. Onların hamısı bu savaşda qətlə yetirildilər.

Düşmənləri yandırıb-yaxan şah bir neçə gün orada qaldı. İti qılıncın çeşməsi ilə fəth və qələbə fidanını yaşıllaşdırıb su ilə doyurmuş döyüş təcrübəli qorçular o həzrətin hüsn-rəğbəti ilə şərəfləndirilib çeşidli hədiyyələrə layiq görüldülər. [Şah Təhmasib] Heratın hakimiyyət boyunbağısını əvvəlki qaydada Hüseyn xanın boynuna saldı. Çünki o, həmin mərəkədə mərdliklər göstərmişdi. Daha sonra [şah] geri dönüş bayrağını İraqa tərəf qaldırdı. Səbəb bu idi ki, Zülfüqar Bağdadda yağı olmuşdu. Oradan [ayrıldıqdan] sonra Nişapura gəlib o məkanda bir neçə gün qaldılar. Aydın fikirli katiblər Ulu Yaradanın müyəssər etdiyi fəth və qələbə xəbərlərini, zəfər nişanələrini və müvəffəqiyyət parıltısını gözəl ibarələr və incə məcazlarla qələmə aldılar. Səadətli müjdəçilər [dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin ətrafını seyr edərək və dövrə vuraraq [bu xəbərləri hər tərəfə çatdırdılar].

### İmam Rzanın müqəddəs Məşhədinin Übeyd xan tərəfindən ələ keçirilməsi haqqında söhbət

Dinin pənahı olan şah çıxıb getdikdən neçə ay sonra Übeyd xan, Sevincək Məhəmməd sultanla Əbdüləziz sultanı altı min süvari özbəklə İmam Rzanın müqəddəs Məşhədinə tərəf göndərdi. O zaman Əhməd sultan Əfşar, Yaqub sultan Qacar, Ağzıvar xan Şamlu və Pirqulu sultan Şamlu adlı-sanlı qazilərdən üç-dörd min süvari ilə o diyarda idilər. Onlar şəhərdən çıxıb, qətl xəyalı ilə gəlmiş özbəklərlə savaşaraq onları Türüq yaxınlığına qədər qovdular və o şər güruhundan neçə-neçə süvarini həyat atından piyada edib onların namübarək başlarını şəhərə gətirdilər. Bu minvalla təxminən iki ay həmin iki kinli ordu arasında savaş və hərb alovu, vuruş və zərbə tozanağı səngimədi. Yüksək şanlı əmirlər o cənnət nişanlı şəhərin mühafizəsində mümkün qədər səy göstərdilər.

O əsnada bir gecə Übeyd xan özbəklərin bir dəstəsi ilə şəhər ətrafına gəldi. Onun gərənayının sədası qaziləri pərişan etdi. Çünki Məşhədin qala divarının [mühasirəyə] hazır vəziyyətə gətirilməsi hələ tamamlanmamışdı. Tüfəngçilər o gecə qorxaq və hürkək halda əmirlərin yanına gəlib [dedilər]:

- Übeyd xan böyük bir ordu ilə qəzəbli və kinli bir şəkildə [gəlib] çatdı. Sadəcə küçəbəndlərin [köməyi] ilə bu qədər həddən ziyadə qoşuna [qarşı] müqavimət [göstərmək] mümkün deyil.

Ertəsi gün özbək əsgərləri döyüşə başladılar. Qazilər də əllərini oxla kamana atıb, ürək paralayan oxların zərbəsi və sinə yandıran xədənglərin peykanları ilə qaragün düşmənləri yaralayırdılar və öldürürdülər. Amma Məvaraünnəhrin Bəhram kimi qəhredici qoşunu küçəbəndləri tutdu. Xorasan əsgərləri döyüşün bu cür [gedişindən] qorxaq və hürkək oldular, savaşı davam etdirməyi məsləhət bilmədilər və gecənin əvvəlində qaçmağa üz qoydular. Übeyd xan özbəklərin bir dəstəsini qazilərin arxasınca göndərdi. Amma onlar əmirlərə çata bilmədilər və qızılbaşlardan bəzilərini ələ keçirib geri qayıtdılar.

Übeyd xan çoxlu qoşunla şəhərə daxil oldu və qazilərdən təxminən üç yüz nəfəri şəhid etdi. O, öz mülazimlərindən birini orada qoyub Herata yollandı. Hüseyn xan və təcrübəli sərdarlardan ibarət bir zümrə azuqənin azlığından xəbərdar olub işin çarəsini sülhdə gördülər. Xoca İshaq Səyavuşaninin vasitəsilə belə bir sülh bağlandı ki, Übeyd xan bir neçə köç [mənzili] geri otursun, qazilər öz arvadları, uşaqları, yükləri və malları ilə şəhərdən çıxıb özlərini təhlükəsiz bir yerə çatdırsınlar və [Übeyd xan] özbəklərin onların ardınca yürüməsinə imkan verməsin. Əhd-peymanın təsdiqindən sonra Übeyd xan bir neçə köç [mənzili] geri oturdu. Hüseyn xan tamam qazilər və şiələrlə birlikdə Heratdan çıxıb Sistan tərəfə yola düşdü. Elə ki adı çəkilən vilayətin yaxınına çatdılar, Məlik Sultan Mahmud [Hüseyn] xanın yanına bol peşkəşlər göndərdi. O əsnada xanın qulağına çatdı ki, Bəstüzereh[1994] rəiyyəti yağı olmuşdur və bu səbəbdən onlar yol kəsməyə təşəbbüs göstərirlər. Hüseyn xan və digər şamlular onların üstünə getdilər. Döyüş və vuruşdan sonra müzəffər qoşunlar o bədbəxt qövmə və o iyrənc görünüşlü oğrulara qalib gəldilər və onların mallarını talan etdilər.

---

[1994] Bəzi nüsxələrdə "Bistruzə" yazılmışdır. Bəstvəzrə kimi də oxumaq mümkündür. Ç.N.Seddon "Bistvərzə" (Bîst Warza) deyə oxumuşdur *(Baroda nəşri, II c., s.105).* Bakı nüsxəsində "Bistüzereh" şəklində qeyd edilmişdir.

Həmin vaxt məlum oldu ki, Kic[1995] və Məkran vilayətində çoxlu mallar var və oranın hakimi Məlik Dinar çox qoca və pərişandır. Qazilər o vilayəti də çalıb-çapdılar və bol mallar ələ keçirib Şiraza yollandılar.

### Übeyd xanın Heratı tutması haqqında söhbət

Qazilərin Heratdan köçməsindən sonra Übeyd xan çoxlu qoşunla şəhərə daxil olub səltənət kürsüsünə əyləşdi. Özbək yaramazları və Səmərqənd xariciləri zülm və sitəm əlini türkə və tacikə, uzağa və yaxına uzatdılar. Həmin günlərdə o natamam qövmün törətdiyi işlərdən biri bu idi ki, Herat əhlindən bir kəsdə bir az sərvət olduğunu güman etsəydilər, onu tutub qazının yanına aparırdılar və deyirdilər ki, bu kişi qızılbaşın zamanında səhabəni lənətləmişdir. [Qazı] vəziyyəti araşdırmadan, sadəcə iki nəfər səadətsiz yalançının şahidliyini eşitməklə həmin bədbəxtin qətlinə hökm verirdi. Möhtəsiblər haqsız bir şəkildə onu çəkə-çəkə Herat çarşısına aparırdılar və orada oğrular kimi qətlə yetirirdilər. Yetərincə təəssübkeş sünni məzhəbli adamlar vardı ki, onlara mallarına görə şiə dedilər və həmin vaxt öldürüldülər. Eyni zamanda, yetərincə möhtac şiələr və tacsız (yoxsul) məvalilər[1996] vardı ki, sərvətə malik olmadıqları üçün salamat qaldılar. Məzlum halda qətl edilənlər və məlum şəkildə öldürülənlər cümləsindən biri Mövlana Hilalidir ki, tezliklə onun əhvalatını bəyan edəcəyik.

### Dinin pənahı olan şahın Bağdada qoşun çəkməsi və Zülfüqarın öldürülməsi haqqında söhbət

Bu il dinin pənahı olan şah, ağıl mühəndisinin miqdarını bilməkdən aciz qaldığı və fəhm müstövfisinin hesablamaqdan heyran olduğu qədər qeyri-məhdud bir qoşunla və saysız ordu ilə Bağdada yola düşdü və Cürbadəqan[1997] yaylağından keçib Bağdad tərəfə hərəkət etdi. Hər [köç] mənzilində dəniz kimi coşan və ildırım kimi gurlayan bir dəstə qoşun onun xidmətinə çatırdı, niyaz və ehsan şərtlərini yerinə yetirirdi.

O vaxt aləmi işıqlandıran günəş Xərçəng bürcündə qərarlaşmışdı və hərarətin şiddətindən zəmanə atəşli büsat qurmuşdu. Havanın istisindən yaqut kanın içində əriyirdi və ləl kimi [parlayan] günəşin şəfəqləri[1998] suyun dibindəki çınqılı mayeyə çevirirdi.

Nəzm

“Günəş elə atəş yayırdı ki,
Parıltısından dərhal dil yanırdı.
Yandırıcı günəş seyrə çıxmışdı,
Hamı öz yağında kabab olurdu.
Su o qədər qızmışdı ki, atəşli Səməndər,
Suya tərəf gəlsəydi istidən yanardı”.

Elə ki ali mənşəli şah Pərvərdigarın yardımı ilə Bağdadın yaxınlığına cah-calalla nazil oldu, fələk qüdrətli əsgərlər qalanın ətrafını dövrəyə aldılar. Zülfüqar etibarsız fırıldaqçıların himayəsindən məğrur olub bu xanədanın (Səfəvilərin) nemətinə nankorluq göstərdi, qeyri-mümkün xəyallara düşdü, savaşmaq və vuruşmaq qərarına gəldi. Düşməni yandıran ordu qaragün üsyançılarla hər gün hərb etdi. Zülfüqara mülazimlik edən və Sufi Xəlil Mosullunun nəvəsi olan Əli bəy və onun qardaşı Əhməd bəy bir neçə gündən sonra, pəncşənbə günü, şəvval ayının 3-də (10.06.1529) Pərvərdigarın yardımı ilə o mərdimazarın üstünə gedib, iti qılınc zərbəsi ilə Zülfüqarın başını bədənindən ayıraraq ali taxtın ətəyinə gətirdilər və Bağdad fəth olundu. Zülfüqarın mülazimləri tam çarəsizlikdən özlərini Dəcləyə vurub su keçidindən cəhənnəm atəşinə vasil oldular. Bəziləri isə qəzavü-qədər pəncəsinin əsirinə çevrildilər. Dinin pənahı olan şah, Əli bəyə əmirlik verib Cürbadəqanı ona tiyul təyin etdi və Bağdad əyalətini xanlıq ləqəbi ilə birgə Məhəmməd sultan Şərəfəddinoğluya verdi. [Daha sonra] o həzrət tamam-kamal əzəmətlə şəhərə tərəf yollandı. Qələbə şüarlı bayraq Pəvərdigarın hüsn-rəğbətinin zəmanəti ilə xilafət mərkəzi (darülxilafət) Bağdada daxil oldu. Şahın ədalət nurları o vilayətin ətrafını işıqlandırdı. Onun qayğıkeşlik günəşi mərhəmət kölgəsini o məmləkətin əhalisinin başına saldı.

---

[1995] Baroda nəşri: “Kəc”.
[1996] Məvali – ərəbcə “mövla” sözünün cəmidir. Ərəb olmayan müsəlman xalqlar üçün istifadə edilən bir termin idi. Xətai öz şeirlərində tərəfdarlarını bəzən “məvali” adlandırır. Burada da Səfəvilərin tərəfdarları, şiələr mənasında işlədilmiş ola bilər.
[1997] Bakı nüsxəsi: “Cərfadqan”.
[1998] Baroda nəşri: “atəşləri”.

Car çəkdirildi ki, heç kəs şəhərdə müsəlmanlara qarşı əziyyət və təzyiq etməsin! Ərəb hakimlərinin elçiləri Bağdadın fəthini təbrik üçün gəldilər, layiqli töhfələr və müvafiq peşkəşlər təqdim etdilər.

Dinin pənahı olan şah İraqi-Ərəbin zəbtindən sonra günəş kimi parlayan bayraqlarını qaldırıb İraqi-Əcəmə tərəf hərəkət etdi.

**Müxtəlif əhvalatlar**

Bu il hökmdarın qışlağı Qəzvində oldu.

Həmçinin bu il dinin pənahı olan şah, Əmir Nemətulla Hillini sədarət mənsəbində Əmir Qivaməddin Hüseynə şərik etdi.

**Ölümlər**

Mövlana Hilali zəmanə şairlərinin ümdəsi və dövran bəlağətlilərinin seçilmişi idi. Qəsidələri, qəzəlləri və məsnəviləri nəzmin tam mükəmməlliyi və bəlağəti ilə yaradırdı. Bu il həsəd əhlindən ibarət bir zümrə – axirətdə onların "boynuna xurma lifindən hörülmüş ip bağlanacaq"[1999] – Übeyd xana dedi ki, Mövlana sənin həcvində bir rübai deyib və axırıncı beyti belədir:

Nəzm

"Qarət edirsən və müsəlmanların[2000] mallarını aparırsan,
Mən kafir olum, əgər sən müsəlmansansa".

Həmçinin onun sərvətinin də çox olduğunu söylədilər. Qəbahətli hərəkət edən xan, sərvətinin çoxluğu səbəbindən onun həbsinə hökm verdi. Xeyli əzablardan və saysız əziyyətlərdən sonra o dövran nadirini Herat çarşısında qətlə yetirdilər. Baxmayaraq ki, bu beytləri Übeyd xanın mədhində söyləmişdir:

Nəzm

"Xorasanın sinəsinə sanki təzə can gəldi,
Yəni ki, oraya Übeydulla xan gəldi.
Onun qızıl nallı atı günəşə bənzəyir,
Ki, şərqdən qərbə getdi və bir gecə ortaya çıxdı.
Mərdlik meydanında Rüstəm pəncəsi kimi əli qüvvətlidir,
Onun əlinin qabağında heç bir əl tab gətirə bilməz.
Şeirdə xəta olar, xətamın üstündən xətt çək ki,
Ya qələm səhvindən düşüb, ya dilin səhvindən gəlib".

## 936-CI İLDƏ (05.09.1529 – 24.08.1530) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

**Dinin pənahı olan şahın Xorasan tərəfə getməsi**

Bu il Übeyd xan hərəkət bayrağını Fərah tərəfə qaldırdı. Ali mənşəli şah tərəfindən o diyarın hakimi olan Əhməd sultan Əfşar qalaya sığındı. Übeyd xan qalanı dairə kimi əhatəyə aldı. Neçə gün sonra ona məlum oldu ki, həmin qalanı əfşar camaatının əlindən almaq asan məsələ deyil. [Bu üzdən] geri dönüş təbilini vurub Herata gəldi. Orada bir neçə gün vaxtını keçirdikdən sonra şahın gəlişi barədə xəbər yayıldı. Qeyd olunan ilin zilhiccə ayının 21-də (16.08.1530) [Übeyd xan] Heratı qoyub Mərvə qaçdı və gözəl nitqə malik elçiləri Turan sultanlarının yanına yollayıb onları çağırdı. Xanlar tam təcili şəkildə Mərvdə ona qoşuldular. Übeyd xan qazilərin dəf olunması barədə onlarla məşvərət etdi. O vaxt cəmi özbəklərin padşahı olan Əbu-Səid xan dedi:

- Biz qızılbaşlara müqavimət göstərə bilmərik. Sən malik olduğun qoşunla onlarla savaşa bilərsənsə, lap yaxşı! Yoxsa gərəkdir ki, öz mülkünlə kifayətlənəsən. Bu vaxtlarda hər nə qədər qızılbaş qoşunu ilə müharibə etdiksə, kədərdən başqa heç nə görmədik.

---

[1999] *Qurani-Kərim, "Ləhəb" ("Məsəd") surəsi, 5-ci ayə.* Müqəddəs kitabımızda bu ifadə Məkkə kafirlərinin başçılarından olan Əbu-Ləhəbin arvadı haqqında deyilmişdir.

[2000] Ellis nüsxəsi və Baroda nəşri: "yetimlərin".

Elə ki Übeyd xan onların yardımından ümidini üzdü, həmin vaxt dinin pənahı olan şahın yanına göndərdiyi elçi gəlib [qızılbaş] qoşununun [say] çoxluğu barədə xəbər gətirdi. Bu səbəbdən Übeyd xan Buxara tərəfə qaçdı.

Bundan öncə, Übeyd xanın yenə də üsyan alovunu alışdırıb Xorasana gəldiyi və Herat şəhərini tutduğu [barədə xəbərlər] dinin pənahı olan şahın qulağına çatdıqda, Xorasan yürüşünə çıxmağı qərara alıb iltifat zülalını müzəffər ordunun əhvalı üzərinə saldı, əmirləri, müqərrəbləri və b. cavanları atla, zirehlə, cövşənlə, bəktərlə təmin edərək məsud bir saatda və gözəl bir zamanda Xorasan tərəfə yola düşdü.

Nəzm

“Ən uğurlu saatda Cəmşidə bənzər şah,
Ölçüyəgəlməz bir qoşunla hərəkətə keçdi.
Qoşun qiyamət şövkətli dağ kimi yeriyirdi,
Qiyamət idi, sanki dağ yol gedirdi.
Yolda olan atların parlaq nallarından,
Zəmin ayla dolu asimana dönmüşdü”.

Hər gün hakimlər və sərdarlar hökmdarın ordusuna qoşulurdular və nəvaziş tapırdılar. Elə ki [dünyanın insanla] məskunlaşmış dörddə bir hissəsinin padşahı o vilayətə yetişdi, Übeyd xanın və b. sultanların elçiləri səadətin məskən saldığı astanaya gəldilər. Onlar əmirlərin vasitəçiliyi ilə asimana bənzər bargaha daxil oldular və gətirmiş olduqları *məktubu və*[2001] xəbəri ərz etdilər.

[Übeyd xanın Şah Təhmsibə yazdığı] məktubun surəti budur[2002]:

“Səltənət və ədalətin ünvanı, həşəmət sahibi, əyalət ağası, cah-calal yiyəsi və mənalardan nəsib alan Təhmasib mirzə tərəfindən varid olmaq şərəfi tapmış şanlı məktub və istəkli səhifə yaxşı bir zamanda və bəyənilən bir saatda çatdı və dəfələrlə bəyan etdikləri sözlər [tərəfimizdən] eşidildi.

Hər iki tərəfin qoşunlarının yürüşləri ucbatından Xorasanın xaraba qaldığı haqqında yazdıqlarınız həqiqətə uyğundur. Bizim məqsədimiz odur ki, Həzrət Rəsulun (ə), Raşidi xəlifələrinin və mömin imamların zamanından üzü bəri aləmdə və aləm sakinləri arasında intizam tapmış olan din, ümmət və məzhəb dəyişdirilməsin. Əgər zəmanənin fəsadı səbəbindən peyğəmbər ümmətinə xələl və ziyan dəyərsə, imkan daxilində bunun dəf edilməsi və aradan qaldırılması üçün çalışmaq bizə vacibdir. Şəhid xaqan[2003] – Allah onun dəlilini nurlandırsın – qəzavü-qədər camından şəhidlik şərbətini içdiyi vaxtdan etibarən Xorasan camaatı bidət və zəlalət əhlinin əlində giriftar olub istər-istəməz şiəliyə və rafiziliyə[2004] tabe olmuşdur və bu sifət həmin camaatın xasiyyətinə və təbiətinə çevrilmişdir. Buna görə də onlar lazımi şəkildə islamın ulu ordusunun qeydinə qalmırlar və köməklik göstərmirlər. O səbəbdəndir ki, onlar xaraba qalmağa üz tutmuşlar. Sədaqət üzündən islam qoşununa yardım edib din yoldaşlığı nümayiş etdirən kəslərə isə yaxşı məlumdur ki, [biz] onların barəsində nə cür iltifatlar göstərmişik. Fəqət nifaq içində olan və islama itaətdən boyun qaçıran şəxslərə gəlincə, onların başına gələn pərişanlıqlar zülm sayılmaz. Necə ki deyiblər:

Beyt

Bu zülm[2005] ki, aləmdə peydadır,
Hamısı zülm görkəmli ədalətdir.

Əgər bunlar olmasa, niyyətimizdə və fəaliyyətimizdə islam əhlinin rifahından, ədalətdən və mülkün abadlığından savayı heç nə yoxdur və olmayacaqdır. “Əməllər niyyətlərə görədir” kəlamının zərurətinə uyğun olaraq, ümidimiz var ki, öz niyyətimizə müvafiq dərəcə tapaq.

Bundan əlavə, yazmışdınız ki, keçən il o cür tənbeh olunmağınıza[2006] baxmayaraq, nə üçün yenidən Xorasan səltənətinin arzusunu edirsiniz? Özünüzə məlumdur ki, islam qoşununun şövkəti sizin ordunuza necə üstün gəlmişdi. Firdovsinin dediyi kimi:

---

2001 Bakı nüsxəsi (130b).
2002 Məktubun mətni Məclis nüsxəsində yoxdur.
2003 I Şah İsmayıla qarşı Mərv döyüşündə (1510) öldürülmüş özbək hökmdarı Məhəmməd Şeybani xan nəzərdə tutulmuşdur *(Nəvai, şərhlər, s.1187).*
2004 Rafizi – inkar edən, dindən çıxan deməkdir. Bəzi radikal qruplar şiələri həqarətlə “rafizi” adlandırırdılar.
2005 Baroda nəşri: “zülmət”.
2006 Bodleian nüsxəsi: “bəlaya düşməyinizə”.

Beyt

Atların tapdaqlarından o geniş çöldə,
Zəmin altı oldu, asiman yeddi.

İki tərəfin qaldırdığı toz-torpaq içində qoşunlarınız qaçdıqdan sonra islam qaziləri bu fürsəti qənimət bilib onların mallarını və əşyalarını əxz etməklə məşğul oldular. Amma onlar bir dəstə [qızılbaş əsgərinin] tozanağın ortasında məxfi qaldığından qafil idilər. Təqdirə uyğun şəkildə belə bir hadisə baş verdi. Hərbçilik aləmində bu cür işlər eyib deyildir.

Nəzm

Lovğalanıb demə ki, əlimdə ağıl əsası var,
Çünki fitnənin əli uzundur və çubuğun iki başı var.

Həzrət Rəsulun (ə) bir dişinin şəhid olduğu (sındığı) Uhud qəzavatından sonra neçə-neçə fəth və qələbə islam əhlinə nəsib oldu. Əgər o həzrətin ümmətləri də o həzrətə bənzəsələr, ondan sonra fəth və qələbələr üz verər. Heç eybi yoxdur. İslam dəryalarının dənizçiləri ona görə şövq gəmisini qəzavatın[2007] dərin bəhrinə salmışlar ki, gerçəklik sədəfini əldə etməyincə və şahvar incini ovuclarına almayınca aram tutmasınlar. [Onlar] bu qədər zahiri zərər və nöqsana baxmayaraq, himmət ayağını mərdanəlik və cürət meydanlarından geri çəkməyəcəklər.

Şeir

Ta o yeganə dürr torumuza düşməyincə,
Biz ayağımızı dəniz sahilindən çəkməyəcəyik.

Ötən dəfə ordu və qoşunumuza belə bir hal-qəziyyə üz versə də, [Allahın] tərifli hüsn-rəğbətindən bir ümidim var ki, bu dəfə olub-keçənlərin əvəzini çıxacağıq və məqsədimiz hasil olacaqdır. Necə ki demişlər:

Nəzm

İtmiş Yusif yenə gələr Kənana, qəm yemə!
Qəmxana dönüb olar bir gün gülüstan, qəm yemə!
Fələyin dövrü əgər iki gün bizə tərəf dönmədisə,
Daima eyni cür qalmaz dövranın halı, qəm yemə!
Bax ha, ümidsiz olma, çün qeybin sirrinə vaqif deyilsən,
Pərdə arxasında var pünhan oyunlar, qəm yemə!

Şanlı və ulu Allah islam əhli barəsində bu cür tənbehləri çox etmişdir.

Daha sonra [öz məktubunuzda] bizim beytimizi yazmışsınız:

Şeir

Heratı tutaram ilahi lütf ilə,
Ordumla yeriyərəm Şam və Təbrizə.

“Fal yaşananlardan görünər” məzmununa uyğun şəkildə, niyyətimiz, fikrimiz və əndişəmiz həmişə [yuxarıdakı beytdə ifadə etdiyimiz] bu kəlamın mənası ilə üst-üstə düşür. Hər işin öz vaxtı vardır. Əzəli kərim və əbədi hakim [olan Allahın] hüsn-rəğbəti islam qoşununa yoldaş olduğu üçün bizim hələ bundan da artığına təvəqqemiz vardır. Digər bir beytimizi də yazmışsınız ki:

Nəzm

Aslanların aslanıyam, mən döyüşkən bir ərəm,
Aslanların zərbəsiylə yerimdən tərpənmərəm.

Yəni [bununla demək] istəyirsiniz ki, Heratı qoyub Mərvə tələsməyim bu beytimin məzmununa xilafdır. Əgər özünüzün xəbəriniz yoxdursa, onda bilən adamlardan soruşun ki, kafirlərin qələbə çaldıqları vaxtda Həzrət Rəsul (ə) Məkkədən nə yolla hicrət etdi və mühacir, ənsar deyilənlər o zamandan zühur etdilər[2008]. Möminlərin faydası, yəqinlik əhlinin rifahı və din qoşununun cəmləşməsi baxımından Heratda qalmaq məsləhət deyildi. Buna görə də məkanımızı dəyişdirdik. Necə ki demişlər:

---

[2007] Baroda nəşri: “qəzavü-qədərin”.

[2008] Məhəmməd peyğəmbər miladi təqvimlə 622-ci ildə bütpərəstlərin təzyiqləri üzündən Məkkəni tərk edib Yəsrib (Mədinə) şəhərinə köçməli olmuş və bu hadisə müsəlman (hicri) təqviminin başlanğıcına çevrilmişdir. Onun Məkkədən Mədinəyə gəlmiş ardıcılları

Nəzm

Qəflətən bir aqil qəzadan, bəladan qaçdı,
Cahil tənə vurdu ki, filankəs qəzadan qaçdı.
Əgər səbəbdən səbəbə qaçmaq rəva deyildirsə,
Xeyrülbəşər Məkkədən Yəsribə[2009] nə üçün qaçdı?

Həzrət Əmirülmöminin Əli (ə) özünün dürr yüklü kəlamında bu beyti buyurmuşdur:

Şeir

Ölümdən qaçmaq üçün iki günü seçmək məcburiyyətindəyəm,
Birisi ölümün təqdir edilmədiyi gündür, digəri isə ölüm günüdür.

Bu mənaya uyğun surətdə biz də vahid [Allahın] qəzavü-qədəri daxilində məkan dəyişdirdik. Allaha həmd olsun ki, bu hicrətimiz Həzrət Rəsulun (ə) həmin sünnəti tərzində baş vermişdir. Bu işdə kimsə bizə tənə edərsə, onun tənəsi Rəsula da aid olar. Bu üzdən həmin işə tənə vurmaq son dərəcə cahillikdir.

Daha sonra deyirsiniz ki, sizin əmirlərinizdən biri olan Durmuş xan Heratda elə bir firavanlıq yaratmışdı ki, camaat mərhum padşah Sultan Hüseyn mirzənin zamanını unutmuşdu. Məgər adı çəkilən padşahın zamanında mədrəsələr və xanəgahlar bu rüsvayçılıqda idimi? Məscidləri və məbədləri atların və eşşəklərin tövləsinə, bəlkə, lap ayaqyoluna çevirmişdilərmi? Bütün zərnigar kaşıları viran etmişdilərmi? Qapıları və taxtaları odun kimi aparmışdılarmı? Əksər məscidləri şərabxanaya və günah məkanına döndərmişdilərmi? Biz səadətlə şəhərə gəldiyimiz zaman ilk öncə Sultan Hüseyn mirzənin mədrəsələrinin, xanəgahlarının və s. xeyriyyə binalarının təmirinə səy göstərdik, adamların və heyvanatın tör-töküntülərini məscidlərdən və məbədlərdən bayıra çıxarıb [oralar üçün] müdərrislər, tələbələr və xadimlər müəyyən etdik. [Oraları] abadlaşdırdıq. Durmuşun [yaratdığı] firavanlığın keyfiyyəti bu hadisədən məlum olur.

Daha sonra yazmışsınız ki:

Misra

Məzlumların ahının oxundan həzər eylə!

Ey əziz! Mövcudluğu vacib olan həzrətə (Allaha) aydındır ki, bizim əsgərlərimizdən bir möminə ziyan dəyməsinə əsla razı deyiləm, bu işə razılıq vermərəm və belə bir şey bizim niyyət və fəaliyyətimizdə yoxdur. Əgər qəflətdən və ya səhvdən [bu cür bir hadisə] olubsa da, [bizim ondan] xəbərimiz olmayıb. Buna görə də "Hər kəsin qazandığı günah ancaq özünə aiddir, heç bir günahkar başqasının günah yükünü daşımaz"[2010] ayəsinin səadətli məzmununa uyğun şəkildə əfv ediləcəyəm. Yox, əgər [hadisədən] xəbər tutduqdan sonra bu işlə məşğul olmasam, yalnız o zaman mən məsuliyyət daşımış olaram. Daha sonra yazmışsınız ki:

Misra

Hər kim ki Əli nəsli ilə düşmənçilik edər, məhv olar.

Hər kim ki mömindir, müsəlmandır və axırda nicat tapmaq ümidinə malikdir, [o kəs] keç vaxt Həzrət Rəsulun (ə) ulu səhabələrinin dostluğunu əldən verməz. Elə Həzrət Əmirülmöminin Əli (ə) də onlardan (səhabələrdən) biridir. Onların şanlı övladları ilə düşmənçilik etmək də eyni şəkildə islam dinindən uzaqdır. Amma biz elə bir tayfa ilə mübahisə və mücadilə aparırıq ki, onlar o böyük şəxsiyyətin (Məhəmməd peyğəmbərin) övladları olduqlarından dəm vursalar da, öz atalarının məzhəbini və əqidəsini tərk etmiş, şeytanın lənət və zəlalətinə tabe olmuş, haqqın yolundan sapmış, rafizilik və şiəliyi qəbul etmiş, şeyxeyni[2011] söyməyin küfr olduğunu bilə-bilə bu küfrü gecə-gündüz özlərinə şüar etmişlər. "O, sənin ailəndən sayılmaz"[2012] ayəsinin məzmununa əsasən, Həzrət (Məhəmməd) Mustafa o cür övladlardan bezardır.

Nəzm

Xoşdur ki, övlad əcdadına sadiq xələf olsun,

---

"mühacir" ("köçkünlər"), Mədinədəki tərəfdarları isə "ənsar" ("köməkçilər") adını almışlar *(A.Masse. İslam: tarixi oçerk. Bakı, 1991, s.37-38).*

[2009] Yəsrib – Mədinə şəhərinin köhnə adı.

[2010] *Qurani-Kərim, "Ənam" surəsi, 164-cü ayə;* buna bənzər ayələr üçün bax: *"Fatir" surəsi, 18-ci ayə, "Nəcm" surəsi, 38-ci ayə.*

[2011] İslam tarixində "şeyxeyn" ifadəsi altında Əbu-Bəkr və Ömər nəzərdə tutulur *(M.Efendioğlu. Şeyhayn // TDVİA, cilt: 39, yıl: 2010, s.80).*

[2012] *Qurani-Kərim, "Hud" surəsi, 46-cı ayə.* Nuh peyğəmbərin oğullarından biri onun sözünə itaət etməmiş, kafirlərə qoşulmuşdu. Bu ayə həmin oğlan haqqında nazil olmuşdur.

Əgər naxələf çıxarsa, onu görüm, tələf olsun.
Rəzil xislətli və bəd məzhəbli övlad,
Atası üçün əziyyətdir, öz-özü üçün möhnətdir[2013].

Və doğru xəbər gətirən, "Kəlami-Məcid"də ("Qurani-Kərim"də) xəbər verir ki, "Sur çalındığı gün [insanların] arasındakı əsil-nəsəb (qohumluq) əlaqələri fayda verməz və [onlar] bir-birilərindən heç bir şey soruşa bilməzlər"[2014]. Cəza günündə sorğu-sual nəsəbdən deyil, əməldən olacaqdır.

Daha sonra, Həzrət Mürtəza Əlinin (ə) övladı və dostu olduğunuzu iddia edirsiniz. Lakin o böyük şəxsiyyətin övladı olub-olmadığınız şübhədən xali deyildir. Belə olan təqdirdə onun övladı olduğunuzu axı necə iddia edə bilərsiniz? Çünki Həzrət Rəsul (ə) buyurmuşdur ki, hər kim digər bir kəsin atasının öz atası olduğunu söyləyərsə, lakin əslində həmin adam onun atası deyilsə, o zaman həmin şəxs behiştə daxil ola bilməz. Əgər siz Həzrət Mürtəzanın (ə) övladısınızsa, onda mənə deyin görüm, o böyük şəxsiyyət hansısa bir ölünü gordan çıxarıb yandırıbmı? Neçə-neçə adamların saqqalını, qaşını qırxaraq, qulaqlarına halqa salaraq islam xəlifəsi edibmi? Ömründə bir rükət namaz qılmamış hansısa murdarı, binamazı və söyüşçünü təbərrayi edərək onu öz yaxın adamına çeviribmi? Hansısa bir adama buyurubmu ki, mənə səcdə et?! Həzrət Rəsul (ə) buyurub ki, əgər Allah-taaladan başqasına səcdə etmək rəva olsaydı, mən əmr edərdim ki, qadın öz ərinə səcdə etsin. Buradan aydın olur ki, Allah-taaladan başqasına səcdə etmək rəva deyildir və küfrdür. Lakin bütün bu sadalanan əməllər artıqlaması ilə sizin nəslinizdə vardır. Bu qədər qəbahətə baxmayaraq, bizə moizə oxuyursunuz. İndi özünüzü tanıyın və [xəcalətdən] başınızı yaxanızın içinə çəkin!

Həzrət Mürtəza (ə) elə bir böyük şəxsiyyət idi ki, ulu səhabələrə beyət etmişdi, onların arxasında namaz qılmışdı və onlara tabe olmuşdu. O ulu şəxsiyyətlərin ölümündən sonra isə o həzrət haqq xəlifəsi olmuşdu. Əgər o, həmin ulu şəxsiyyətlərin batil olduğunu bilirdisə, niyə görə onların cəsədinin Həzrət Rəsulun yanında qalmasına izin verirdi və onları oradan çıxarmırdı? Deməli, məlum olur ki, o ulu şəxsiyyətlər haqlı olmuşlar ki, [Həzrət Əli də] onlara qarşı çıxmamışdır. Hər kəsə bəllidir ki, Həzrət Mürtəza Əli (ə) Rəsulun (ə) və kübar səhabələrin yoluna tabe olmuş və heç vaxt onlara qarşı müxaliflik etməmişdir. Sizin ulu əcdadınız mərhum cənab Şeyx Səfinin də haqqında belə eşitmişəm ki, əziz bir adam imiş və əhli-sünnət və camaatdan[2015] imiş. Bizi böyük heyrət bürüyür ki, siz nə Həzrət Rəsulun (ə) yoluna tabesiz, nə də ulu əcdadınızın. Əgər belə isə, o əzizlərin övladı olduğunuz haradan bəlli olur? Necə ki demişlər:

Nəzm

Bir beççənin aslanı qova bilməsi mümkün olmadığı kimi,
Sənin də peyğəmbər haqqında belə danışmağın mümkün deyildir.

Və bundan başqa demişlər ki:

Nəzm

Nəsəbi və nisbəsi bilinməyən adamın,
Yeganə şahidi fəaliyyətidir.

Hər halda o ulu şəxsiyyətlərin[2016] yoluna tabe olan hər kim dünyəvi mənfəət üzündən bidət və zəlalətə boyun əyərsə, "Onların dünyadakı zəhmətləri boşa getmişdir, halbuki onlar yaxşı işlər gördüklərini zənn edirdilər"[2017] ayəsinin məzmununa gərək nəzər etsin və ibrət götürsün.

Misra

Aynanın arxasında tuti sifətim gizlənmişdir.

Bundan başqa, bizim Mərv vilayətində qalmağımızın səbəbi o idi ki, Süleyman məkanlı əlahəzrət paytaxt Səmərqəndin, Daşkəndin, Türküstanın, Əndicanın, Hisari-Şadmanın, Bəlxin, Şibirğanın cəmi xanları və sultanları ilə birlikdə böyük bir qoşunla yola çıxmışdı və bizə məktublar və ismarışlar göndərib təkid etmişdi ki, tezliklə qəzavat səadətinin şərəfinə müşərrəf olacağıq və buna görə də qalibiyyətli əsgərlərin gəlib çatmasına qədər döyüşü təxirə salın ki, biz də bu səadətdən məhrum qalmayaq. Bu günlərdə o həzrətlər külli

[2013] Baroda nəşri: "Öz atası və anası üçün əziyyətdir".
*[2014] Qurani-Kərim, "Möminun" surəsi, 101-ci ayə.*
[2015] Əhli-sünnət və camaat – sünniləri bildirmək üçün istifadə olunan termin.
[2016] Baroda nəşri: "o ulu şəxsiyyətin".
*[2017] Qurani-Kərim, "Kəhf" surəsi, 104-cü ayə.*

cəmiyyətlə birlikdə cah-calalla gəlib çatmışlar. Allahın bir qəzası baş verməzsə, köçhaköçlə qəzavat və cihada yollanacağıq, inşallah. Hər halda, peyğəmbər şəriətinə müxalif çıxanlar və bidətlə zəlalətin ardıcılı olanlar haqqında din böyükləri və yəqinlik əhlinin öndərləri belə buyurmuşlar:

Nəzm

Hər kəs dinə fəsadla xələl gətirirsə,
Yaxud zəkat vaxtı alnını qırışdırırsa,
Həmin adam cəzaya layiq olar,
Və cahanın cabbarı (Allah) onun başına elə vurar ki,
Dəbilqəsinin sorağı Maçin[2018] diyarından gələr.

Nə vaxt ki siz o böyük insanın (Məhəmməd peyğəmbərin) yolunun yolçusu olacaqsınız, bizim sizinlə heç bir mübahisəmiz və münaqişəmiz olmayacaqdır. Lakin indi ki bu gözəl yoldan imtina etmişsiniz, sizi dəf və rəf etmək bizə lazım və vacibdir.

Şeir

Bizim sizinlə aramıza təəssübkeşlik girmişdir,
Lakin bu təəssüb şan-şöhrətdən deyil, dini təəssübdür.

Şeir

Əməllərimiz halımıza dəlalət edər daim,
Bunlardan ibrət al ki, davamın gəlsin.

Vəssəlam! "[Ey Məhəmməd!] Müjdə ver o kəslərə ki, sözə qulaq asarlar və eşitdiyi sözlərin ən yaxşısına tabe olarlar"[2019].

*Dinin pənahı olan şah tərəfindən həmin məktuba verilmiş cavab:*

*"Zəlalət və cəhalət çölünün sərgərdanlarının şikəstə yazan qələmi, yaramazlıq və sapqınlıq vadilərində azmışların şirk[2020] əlamətli kilki[2021] ilə təsvir edilmiş və yazılmış əcaib imlalı və qəribə inşalı məktub, zəfərin yaxın olduğu və qələbənin müşayiət etdiyi üzənginin mülazimi olan bəzi münşilərin nəzərinə dəymiş və məzmunu zati-alilərimizin yüksək ərzinə çatdırılmışdır. Amma bu məzmun [ondan ibarətdir] ki, qələminizin kirli dili ilə Xorasana gəlməkdə məqsədinizin islamın intizamı, bidətin və azğınlığın dəf edilməsi olduğunu yazmışsınız. Məxfi qalmasın ki, itaətsiz və qabiliyyətsiz adamlarınız öz çirkli vücudlarının xəbisliyi ilə Xorasanın gözəl şəhərlərini kədərə və çirkaba batırmışlar, şəhərləri xaraba qoymağa və bəndələrə əziyyət verməyə alçaqcasına səy göstərmişlər. Əmirləriniz uşaqların və qadınların qanını tökməkdən və onların irzinə-namusuna təcavüz etməkdən başqa bir iş görməmişlər və malları soymaqdan və qarət etməkdən, peyğəmbərlər ağasının (Məhəmməd peyğəmbərin) və məsum imamların doğru şəriətinin və mətin dininin qanunlarını pozmaqdan savayı heç nə törətməmişlər.*

*Nəzm*

*Ey Allahdan bixəbər nadürüst,*
*Və ey qədəmi islam yolunda süst olan!*
*Bu qarəti və yağmaçılığı tərk et,*
*Məni eşit və hökmranlıq [fikrini] başından at!.*
*Axı nə qədər zülm qübarını yaymaq olar?!*
*Axı nə qədər günahsızların ürəyinin qanını tökmək olar?!*
*Axı nə qədər insanların evlərini yıxmaq olar?!*
*Hesab gününün sorğu-sualından qorx!*
*Sitəmdən, cövrdən və kindən əl çək,*
*Ayağını ətəyinə çək və bir küncdə otur!*
*Əgər belə etməsən, aslan ovlayan, igidlərin sərvəri olan əmirin,*
*Yəni Əlinin ayaq pəncəsinin torpağına and içirəm ki,*

---

2018 Maçin - islam qaynaqlarına görə, Çin tərəfdə bir vilayət.
*2019 Qurani-Kərim, "Zümər" surəsi, 18-ci ayə.*
2020 Şirk- Allaha şərik qoşmaq.
2021 Kilk – qamış qələm.

*Səni parça-parça etməyincə,*
*Mən bu macəradan əl çəkməyəcəyəm.*

*Deyəsən, o ikrah doğuran güruhunuz və o şövkətsiz tayfanız möminlərin mallarını tarac etməyi sonuncu peyğəmbərin (Məhəmməd peyğəmbərin) dininin rəvac tapması və dirçəlişi kimi başa düşür və nahaq qan tökməyi və mütləq surətdə küfr törətməyi Allahın sadiq elçisinin ümmətinin nizam-intizamı və rövnəqlənməsi hesab edir. Ümumiyyətlə, sizlər düzgün dindən və doğru yoldan azmış və sapmışsınız, səfehliyinizin çoxluğu və bədbəxtliyinizin bolluğu ucbatından batil istək və pozğun xəyallarla Mustafanın dininin qanunlarını və Mürtəzanın məzhəbinin qaydalarını inkar etmişsiniz. "Onlara: "Başqaları iman gətirdikləri kimi siz də iman gətirin!" – deyildiyi zaman [öz aralarında]: "Biz də səfehlər (ağılsızlar) kimi iman gətirək?" - deyə cavab verirlər. [Ey möminlər!] Agah olun ki, səfeh onların özləridir, lakin [bunu] bilmirlər"*[2022].

*Nəzm*

*Sənin fəsadından cahan bezmişdir,*
*Səndən Allah və peyğəmbər bezar olmuşdur.*
*Zülm edirsən və buna ədalət adı qoyursan,*
*Sənin ədalətin başdan-başa tam bir zülmdür.*
*Ey mərdimazar, sənin adətin küfrdür,*
*Bu xisləti tərk et, abrın-həyan olsun!*
*Əgər belə etməsən, and olsun Uhud döyüşünün fatehinə*[2023]*,*
*[İbn] Əbdüvədin*[2024] *başını kəsən şəxsə.*
*Səni elə alt-üst edərəm ki,*
*Səndən və sənin adından heç bir nişan qalmaz.*

*Naqis, nalayiq və xəstə sözlərlə, cürbəcür bəlalar və məşhur naxoşluqlarla, pozğun fikirlərə qapılmaq və batil xəyallara düşməklə giriftar olmuşsunuz, cəhalətinizin və fitnə-fəsadınızın çoxluğu, küfrünüzün və inadkarlığınızın bolluğu ilə inad əhlini öz arxanızca aparmışsınız, hədyan və mənasız kəlmələrlə, qarma-qarışıq və batil sözlərlə acizlərin və cahillərin etiqad qayığını küfrün qorxunc girdabına, şirkin batilliyinə və tüğyana salmışsınız. "Onların ürəyində mərəz (nifaq və həsəd mərəzi) var. Allah onların [şəkk, kin və nifaq] mərəzini daha da artırar. Yalan dedikləri üçün onlar şiddətli bir əzaba düçar olacaqlar!"*[2025]

*Nəzm*

*Ey sən, başdan-ayağa zülm və fəsad içində olan,*
*Sənin inadkarlıqdan başqa işin-gücün yoxdur.*
*Sən əvvəlcə özün ədəbin nə olduğunu öyrənməlisən ki,*
*Ondan sonra başqalarına ədəb öyrədəsən.*
*Öz cahilliyin ucbatından bilik iddiası edirsən,*
*Sənin təhsilinin səmərəsi səmərəsizlikdən ibarətdir.*
*Mənim dövlətimi gör və boşbağazlıq etmə,*
*Cəhalətin həddini aşdı, cahillik etmə!*
*Əgər belə etməsən, Mürtəza Əlinin,*
*Kövsərin saqisinin və Xeybəri alan şahın haqqına,*
*Sənin kökünü qılıncla elə qopararam ki,*
*Səndən cahanda heç bir əsər-əlamət qalmaz.*

*Xəbərləri eşitmək qabiliyyətinizin yoxluğu və görmə qüvvətinizin naqisliyi ucbatından hərçənd adlı-sanlı müzəffər qazilər nəciblərin və qorxmaz igidlərin ağasının (Həzrət Əlinin) davranışlarını sizin nəzərləriniz qarşısında həyata keçirsələr də, aslan ovlayan mübarizlər gövhər saçan qılıncın dili ilə məlahətli ayələrin sədasını sizin qulağınıza çatdırsalar da, buna baxmayaraq, hələ də küfr və cəhalət burulğanında sərgərdan, şirk və sapqınlıq (zəlalət) zülmətində çaş-baş qalıb, topuq vuran dilinizlə cürət və cəsarət izhar edirsiniz*

---

[2022] *Qurani-Kərim, "Bəqərə" surəsi, 13-cü ayə.*
[2023] Həzrət Əli nəzərdə tutulur.
[2024] Ərəbistanın ən məşhur pəhləvanlarından olan Əmr ibn Əbdüvəd xəndək döyüşündə Həzrət Əli tərəfindən öldürülmüşdür.
[2025] *Qurani-Kərim, "Bəqərə" surəsi, 10-cu ayə.*

*və süst qədəminizlə boş laqqırtı yolunda addımlayırsınız. "Həqiqətən, kafirləri əzabla qorxutsan da, qorxutmasan da, onlar üçün birdir, iman gətirməzlər. Allah onların ürəyinə və qulağına möhür vurmuşdur. Gözlərində də pərdə vardır. Onları böyük bir əzab gözləyir!"*[2026]

*Şeir*

*Ey kəmhövsələ və yaramaz kar,*
*Məndən və mənim dövlətimdən xəcalət çək!*
*Sən karsan və bəxtin kordur,*
*Axı korun və karın əlində nə zor ola bilər?!*
*Döyüş meydanında qədəmin süst olduğu üçün,*
*Sənin boş laqqırtıdan başqa işin-gücün yoxdur.*
*Bir halda ki, sən heç düz yerdə yeriyə bilmirsən,*
*Nə üçün kin ayağını çərxi-fələyin üzərinə qoyursan?!*
*Sən döyüş səfinə qədəm qoyduğun zaman,*
*Aslanlar qarşısında tülküdən də acizsən.*
*Savaş növbəsidir, özünü mərd kişilər kimi apar,*
*Qılınc qırmızı [qana] boyandıqda çöhrən saralmasın.*
*Kişi kimi qorxunu başından at,*
*Arvadlar kimi bir daha üzrxahlıq etmə!*
*Savaşmaq üçün bir-iki addım irəli gəl ki,*
*Heç kim sənin sözünə vəfasız çıxdığını duymasın.*

*Təqlidçilik qələmi ilə cidd-cəhd sətrinə öz əcdadlarınızın inancına riayət etdiyiniz barədə bir neçə söz yazmışsınız. Məxfi qalmasın ki, əgər əcdadlar cümləsindən kimsə bir müddət batil məzhəbdə olmuş və öz könül səhifəsini boş etiqadlarla kirləndirmişdirsə, ona əsaslanmaq və onun gəldiyi nəticəyə gəlmək lazım deyildir. "Qurani-Məcid"də və doğru kəlamda əksini tapmış bəlağətlə dolu bu məzmundan xəbərsiz olmaq və ona laqeyd yanaşmaq olmaz. Mübarək və Ulu Allah buyurmuşdur: "Onlar: "Biz atalarımızı bir din üzərində gördük və biz də onların ardınca getdik!" – deyirlər. [Ya Rəsulum!] Biz səndən əvvəl hər hansı bir məmləkətə [Allahın əzabı ilə] qorxudan bir peyğəmbər göndərdiksə, oranın naz-nemət içində yaşayan böyükləri (varlıları) sadəcə olaraq: "Biz atalarımızı bir din üzərində gördük və biz də (təqlidlə) onların ardınca getməkdəyik!" – dedilər. [Hər peyğəmbər öz ümmətinə] belə dedi: "Əgər sizə atalarınızın sitayiş etdiyini gördüyünüz dindən daha doğrusunu gətirmiş olsam necə?!" Onlar: "Biz sizinlə göndərilənləri inkar edirik!" – deyə cavab verdilər. Buna görə də Biz onlardan intiqam aldıq. [Ya Rəsulum!] Bir gör [peyğəmbərləri] yalançı sayanların axırı necə oldu!"*[2027]

*Nəzm*

*Təqlid bayrağını açmışsan,*
*Təhqiq evini yıxmışsan.*
*[Sözümü] eşit, çox da təqlidçi olma,*
*Əcdadına bu qədər tabe olma!*
*Sənin təqlidçiliyin kimi bir təqlid yoxdur,*
*Allahın lənəti olsun sənə də, sənin təqlidinə də!*

*Dağınıq yazan qələminizlə bu kəlmələri bəyan edirsiniz ki, biz Raşidi xəlifələrə tabeyik və onların yolu Allahın rəsulu olan həzrətin – Allahın salamı olsun ona və nəslinə – yoludur. Yanlış düşüncənizə məfxi qalmasın ki, Raşidi xəlifələrindən əgər təkcə möminlərin əmiri, dindarların imamı, Allahın qalib aslanı olan Həzrət Əli ibn Əbu-Talib – Allahın salamı olsun ona – nəzərdə tutulursa, onun yolu, heç şəksiz və şübhəsiz, haqqın və düzgünlüyün yoludur və biz, Allahın köməyinə müvəffəq olub həmişə bu gözəl yola riayət edirik. Qəti əqli sübutlar və aydın nəqli dəlillər əsasında həm say-seçmə, həm sadə adamlardan ibarət olan bütün insanları küfr və üsyan səhrasından islamın gözəl vadisinə gətirəcəyik. Halbuki o qəddar kafirlərin və o ya-*

[2026] Qurani-Kərim, "Bəqərə" surəsi, 6 və7-ci ayələr.
[2027] Qurani-Kərim, "Zuxruf" surəsi, 22-25-ci ayələr.

*ramaz əclafların[2028] xasiyyəti onun (Həzrət Əlinin) bəyanilən yoluna tamamilə zidd və müxalifdir. Əgər Əbu-Bəkr, Ömər və Osman nəzərdə tutulursa, onların yolu peyğəmbər həzrətlərinin – ona və nəslinə Allahın salamı olsun – gözəl yolu deyildir. Çünki tarix və tərcümeyi-hal kitablarında yazılmışdır və bütün islam əhli arasında məşhurdur ki, Ömər minbərin başında [belə] demişdir: "Allahın rəsulunun zamanında üç şey vardi ki, mən onları haram etdim və onlara əməl edənləri cəzalandırdım. O üç şey – Həcc mütəsi, nisa (qadın) mütəsi və azanda "həyyə əla xeyril-əməl" ("əməllərin ən xeyirlisinə tələsin") cümləsidir". Buna bənzər və oxşar [sübutlar] çoxdur. Lakin sən iman əhlinə son dərəcə nifaq bəslədiyindən, heç bu yöndəmsiz yolda da sabitqədəm və mətin deyilsən.*

*Misra*

*Küfrdə sabitqədəm ol, zünnarı rüsvay etmə!*

*Qırıq qələmlə ibarələri bir-birinə calayıb yazırsan ki, bizim qoşunumuz sizin qazilərinizə qalib gəlmişdir. Bütün aləmə və aləm sakinlərinə məxfi və gizli deyil ki, peyğəmbər nəslinə və imamət xanədanına münasibətdə sədaqət, hüsn-rəğbət, məhəbbət və təvəlla bizim gündən-günə inkişaf edən dövlətimizin alnından peydadır və bizim xoşbəxt talemizin çöhrəsindən zahir və aşkardır. Bizim cahanı fəth edən zehnimizin dünyanı bəzəyən gözəl düşüncəsinin arzusu ədalət dairəsinin genişləndirilməsindən və insaf-mürüvvət meydanının böyüdülməsindən ibarətdir. Biz qələbə çalmışıq və bizim qələbə bayrağımız heç vaxt sınmamış və qırılmamışdır. Savaşın sübh meydanında bəxtsizlik yeli məğlubiyyət tozunu bizim müzəffər yardımçılarımızın və tərəfdarlarımızın bayrağının pərçiminə və ətəyinə qondurmamışdır və çatdırmamışdır.*

*Şeir*

*Mərd və cavanıq mən və mənim bəxtim,*
*Bu iki cavanla dalaşmağa çalışma!*
*Çünki qılıncımın atəşindən qığılcım çıxan kimi,*
*Sənin ömür evin tikan kolu kimi yanar.*

*Lakin əgər qələbə adı altında o yağı tayfanın yarımcan halda, yüz möhnət və məşəqqətlə təhlükəli döyüş meydanında müzəffər qazilərin və xəncər vuran cahangir igidlərin qılınc zərbəsinin qarşısından xilas olmaları, qaragün və bədbəxt bir vəziyyətdə fərar edərək uğursuzluq səmtinə üz qoymaları nəzərdə tutulursa, bu məsələ sizin tərəfinizdən iftixar və öyünmək səbəbi sayılsa da, buna çox da sevinib-şənlənməyin! Çünki bu dəfə izzətli, calallı və ulu həzrətin (Allahın) köməyi, peyğəmbərlər ağasının (Məhəmməd peyğəmbərin), övliyalar sərvərinin (Həzrət Əlinin) və doğru yol göstərən imamların – onlara salam və dua olsun – yardımı və dəstəyi sayəsində az qalıb ki, həmlə zamanı çərxi-fələkdən çevik və say baxımından sabit və səyyar göy cisimlərindən artıq olan müzəffər ordumuz, düşünən beyinləri lovğalıq küləyindən xələl görmüş və ağır yatmış bəxtləri cəhalət yatağında yuxuya getmiş o bədbəxt güruhun həyat suyunun qətrələrini atəş saçan qılıncın qığılcımı ilə həlak torpağı üzərinə səpsin və onların çöhrəsinə ölüm niqabı geydirsin.*

*Nəzm*

*Yer dəbərər, mən dəbərsəm yerimdən,*
*Göy oynayar, mən oynasam yerimdən.*
*Əgər mənim ordum ayağını üzəngiyə qoysa,*
*Səhranın qumunu göyə sovurar.*

*Əgər döyüş günü düşmən ordusu dağ olsa, biz onu yerindən qaldırarıq. Düşmənlə döyüşdə olduğumuz zaman əgər o, çərxi-fələk belə olsa, biz onu qanına qəltan edərik.*

*Əgər qələbə adı altında bu sözün zahiri mənası nəzərdə tutulmuşdursa, kiçikli-böyüklü hamıya və hər kəsə gündüz görünən gün kimi aydın və aşkardır ki, savaş zamanı sizin döyüşüb-vuruşmağa tabınız, mücadilə və müqavimətə taqətiniz olmamış, müzəffər qazilərin və qalib mübarizlərin qan saçan qılınclarının həmləsi qarşısında qaçmağa üz qoyub, Türküstanın ucqarlarına qədər dayanmamışsınız. Həmin əzəmətli cihadda və böyük qəzavatda islam qoşununun hədəfi qənimətlər və mallar ələ keçirmək deyil, bidət və zəlalət əhlinin dəf edilməsi və ortadan qaldırılması olduğu üçün şücaət meşəsinin aslan ovçuları öz alicənablıqları üzündən bəzi malları o qəddar köpəklərə buraxmışlar.*

[2028] Burada Übeydulla xan və adamları nəzərdə tutulur.

*Misra*

*Onlar öz alicənablıqları ilə bu artıq-urtuğu itlərin qarşısına atmışlar.*

*Əgər bunu ərz etməkdə məqsəd islam qoşununun qazilərinin və adlı-sanlılarının (igidlərinin) qorxduğunu bildirməkdirsə, bu məna yetərincə yanlışdır və məntiqdən uzaqdır. Çünki məşhurdur ki, "Qəssab qoyunların çoxluğundan qorxmaz" və "Bol odunları yandırmağa bir qığılcım yetər".*

*Utan özündən və öz qoşunundan,*
*Çünki sənin bəxtin toz-torpağa batıb.*
*Aləmi əgər başdan-başa qarışqa bürüsə də,*
*Süleymanın qarşısında nə edə bilər ki?!*
*Nədir sənin bu bayraq qaldırmağın?*
*Sənin işin qalxanı atıb qaçmaqdır.*
*Ömrünü yüz möhnətlə başa vurmuşsan,*
*Bü müddətdə sən nə hünər etmişsən?!*
*Xanların alnına dağ vuran mənəm,*
*Süleyman mülkünün padşahı mənəm.*
*Şahın nərə çəkmək növbəsi gəlib çatanda,*
*Dastanlardakı Rüstəmin qorxudan ürəyi gedər.*
*Mənim ordum kin yolundan dəm vurarsa,*
*Uhud dağını qaldırıb yerə vurar.*

*İnşallah, tezliklə o tülkübaz və hiyləsaz (hiyləgər) köpəklər can yaxan xəncərin zərbəsi ilə cəhənnəmin dibinə tələsəcəklər və ən kəskin bir şəkildə öz əməllərinin cəzasına çatacaqlar.*

*Ayağı kəsik qələminlə belə bir yanlış məzmuna və boş mənaya işarə edirsən ki, Mərvə qaçmağın Həzrət Rəsula – Allahın salamı olsun ona və nəslinə – itaətdən irəli gəlmişdir. Bu iki sətirdən öncə son dərəcə küfr və zındıqlıq ucbatından özünün zülmət əlamətli gilini nurları bol olan ulduzlarla və özünün murdar görünüşlü saxsını müqəddəslərin öndərinin və xeyirxahların rəhbərinin (Məhəmməd peyğəmbərin) – Allahın salamı olsun ona – şahanə inciləri ilə əlaqələndirməyinə baxmayaraq, hələ bir bu cəsarətinin xəsarətindən əl çəkməyib, hicrəti qaçmaq və qaçmağı da hicrət kimi izah edirsən və şair Caminin bədnamlıq oxuna hədəf olan sözlərinə istinad edirsən.*

*Səndən bezar olsun, ey ədəbsiz,*
*Yəsribin şahı ləqəbli qərib peyğəmbər!*
*Sənin kimi bir kafir və düşkün bir müşrik,*
*Nə Əcəmdə var, nə də Ərəbdə.*

*Peyğəmbər ümmətinin qanununa və Mürtəzanın – ona və nəslinə salavat və salam olsun – məzhəbinin qaydalarına uyğun şəkildə məscidləri və ibadət məbədlərini təmir etməniz barəsində bildirdiklərinizə gəlincə, bu işlər şeytanlara və məlunlara xas olan batil düşüncələr və pozğun xəyallar əsasında həyata keçirilmişdir. Çünki məscidlərin təmiri və məbədlərin tərtibinin məsrəfi cinayət və xəyanət kimi alçaq yollarla əldə olunan mallarından təmin edilmişdir. Bu isə fayda və savabın səmərəsi deyil, kədər və əzabın səbəbidir. Necə ki, bu barədə hələ Həzrət Əmirülmömінin Əli, cəhənnəmlik Müaviyyəyə yazmışdı.*

*Nəzm*

*Bu tövrdə ki, mən səni görürəm, ey sapqın kafir,*
*Sən məscid nə bilirsən və Allahı nə tanıyırsan?!*

*Nəsəb barədə dili kəsik qələminin nazik səhifə üzərinə yazdığı pərişan ibarələr və hədyan kəlmələr bizə çatdı. Gizli qalmasın ki, ali dərəcəli seyidlərin nəsəbləri barədə qeyri-məhdud sayda ətraflı və izahlı kitablar yazılmışdır və bunlar islam əhlinin diyarlarında yayılmışlar və məşhurdurlar. Aşkar, yayğın və aydın olan bu nəsəb, barəsində hələ heç kəsin bir kitab görmədiyi və nəsəbinin gerçəkliyi məlum olmayan digər nəsəblərə, o cümlədən də türklərin nəsəbinə*[2029] *bənzəməz. Bəzilərinin nəsəbinin gerçəkliyi onların əhvalının*

[2029] Burada "türklərin nəsəbi" ifadəsi ilə Şeybanilərin nəsəbinə işarə edilir və Səfəvilərin Məhəmməd peyğəmbərə çatdırılan seyidlik şəcərəsi digər hökmdarların, o cümlədən də Şeybanilərin nəsəbnaməsindən üstün tutulur. Buna baxmayaraq, Səfəvi xanədanının özü də bir türk sülaləsi idi və bu gerçəklik bir sıra Səfəvi qaynaqlarında əksini tapmışdır (bax: *M.Abbaslı. Safevîler'in kökenine dair*

*çöhrəsindən bəllidir və aydındır. Bəlkə də, Həzrət Əmirülmömininin – ona salam olsun – qəzəbini büruzə verən bu şeir sizin nəsəbinizin gerçəyi haqqındadır:*

*Şeir*

*Hər kimin Əli nəslinə məhəbbəti yoxdursa,*
*Onun haqqında sözü uzatmağa hacət yoxdur.*
*Kimin əlində atasının qolçağı yoxdursa,*
*Onun anasının ətəyində namaz qılmaq olmaz.*

*O həzrəti sevmək yanlış bir əməl deyildir və onsuz insan təbiətinin pak olması mümkün deyildir. Əgər, Allah eləməmiş, bir kimsənin ətəyi toza batıbsa, deməli, o məhəbbətin dadı onun damağına çatmamışdır.*

*Nəzm*

*Şahi-Mərdanı sevməyənin atası naməlumdur,*
*Çünki yad kişinin əli tutub onun anasının ayağını.*

*Amma səcdənin qadağan olduğu barədə xəta mahiyyətli ədanıza cavab budur ki, ibadət niyyəti ilə bəndələrə səcdə etmək haramdır və bu cür səcdə yalnız Uca Allaha edilməlidir. Lakin bəndələrə təzim mənasında səcdə etmək caizdir. Çünki Yusif peyğəmbərin – ona salam olsun – qardaşları ona səcdə etmişdilər. Necə ki, gerçəkləri bilən Mübarək və Ulu Allah öz kəlamında buyurur: "Hamısı onun qarşısında səcdəyə qapandılar"[2030]. Bu mənadan imtina edib itaət və tabeçilikdən boyun qaçıran şeytan özünə əbədi olaraq tənə və lənət qazandı. Necə ki, Allah-taala buyurur: "Biz mələklərə: "Adəmə səcdə edin! – dedikdə İblisdən başqa [hamısı] səcdə etdi. [Yalnız] o, lovğalanaraq [səcdə etməkdən] imtina etdi və kafirlərdən oldu"[2031]. Beləliklə, bu səcdəni o səcdə ilə qarışdırmaq lazım deyil.*

*Həzrət Mürtəza Əlinin – ona salam olsun – Əbu-Bəkrin, Ömərin və Osmanın səfində namaz qıldığı və onlara beyət etdiyi haqqında ciyiltili qələminizdən təlatümlü yazınıza tökdüyünüz məzmuna gəlincə, məxfi qalmasın ki, bütün insanlara və tamam camaata aydın və məlum, hamı üçün dəqiq, müəyyən və bəlli olduğu kimi, əhli-sünnət kitablarında, həm müxaliflərdən, həm də müvafiqlərdən zikr və qeyd edildiyi kimi, möminlərin əmiri, dindarların imamı, kafirlərin və münafiqlərin qatili, Allahın qalib aslanı olan Həzrət Əli ibn Əbu-Talib – Allahın salamı olsun ona – ömrünün əvvəlindən başlayaraq dünyadan köçdüyü vaxta qədər xilafətin ismətini üsyan və xəta tozuna bulaşdırmamışdır. O, həzrət peyğəmbərə – Allahın salamı olsun ona və nəslinə – bütün möminlər və müsəlmanlar, yaxınları və qohumları arasında hamıdan daha yaxın olmuş, ən uca məramlara və peyğəmbərlərə xas olan yüksək və şanlı mərtəbələrin ən ali mərtəbələrinə çatmışdır. O həzrətin tərifəlayiq əhvalatları haqqında çoxlu ayələr və saysız hədislər mövcuddur. Onun düz qaməti "İnnəma" və "Həl-əta"[2032] xələti ilə süslənmiş, ali məramlı xilqəti də "Mən elmin şəhəriyəm, Əli isə onun qapısıdır" [hədisinin] zinəti ilə bəzənmişdir. Həzrət peyğəmbər – Allahın salamı olsun ona və nəslinə – Qədir-Xum günündə, vida həccindən qayıdarkən səhabələrinə buyurdu ki, "Mən hər kimin mövlasıyamsa, bu Əli də onun mövlasıdır. Pərvərdigara! Əlini sevənləri sev, onun düşmənləri ilə düşmən ol! Ona məhəbbət bəsləyənlərə məhəbbət bəslə! Ona kömək edənlərə kömək et, köməyini əsirgəyənlərdən köməyini əsirgə!". [Peyğəmbər] o həzrətə buyurmuşdur ki, "Sənin mənə olan nisbətin Harunun Musaya olan nisbəti kimidir". Həmçinin [peyğəmbər] bu fəsahətli kəlamı mübarək dilinə gətirmişdir: "Sən mənim qardaşımsan, sən mənim varisimsən, sən mənim xəlifəmsən və dinin qazısısan". O həzrətin əjdahanı məğlub etməsi, cinlərlə müharibəsi, böyük qayanı dəf etməsi, Xeybərin qapısını qoparması kimi açıq-aşkar möcüzələri və kəramətləri çoxdur və saysızdır.*

*Nəzm*

*O, heç şübhəsiz, [peyğəmbərin] varisidir,*
*Allahın aslanı və "vilayət" şahı Əlidir.*

---

*// TTK, "Belleten", sayı: 158, Ankara, 1976, s.287-329; О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.39-41; N.S.Musalı. I Şah İsmayılın hakimiyyəti, s.87-90*).

[2030] *Qurani-Kərim, "Yusif" surəsi, 100-cü ayə.*

[2031] *Qurani-Kərim, "Bəqərə" surəsi, 34-cü ayə.*

[2032] Burada qeyd edilən "İnnəma" ifadəsi "Qurani-Kərim"in "Maidə" surəsinin 55-ci ayəsinə, "Həl-əta" ifadəsi isə "İnsan" surəsinin 1-ci ayəsinə işarədir. Şiələr bu ayələrin Həzrət Əli haqqında nazil olduğuna inanırlar.

*Odur "la-fəta" çəməninin fidanı,*
*Münafiqləri qıran və Xeybəri fəth edən odur.*
*Odur zülfüqarın zərbəsi ilə,*
*Bütün kafirlərin damarını qoparan.*
*Odur ümmətin həqiqi rəhbəri,*
*Hamının ümidi onun kəráminə bağlıdır.*
*Kim ki, qəbul etməsə Mustafadan sonra,*
*Doğru yolu göstərənin Mürtəza Əli olduğunu,*
*Haqqın lənəti olsun həmin bədbəxtə,*
*Qatı kafir o bədzatdan yaxşıdır.*

*Əbu-Bəkr, Ömər və Osman isə islamı qəbul etmələrinə baxmayaraq, zahirən və batinən nifaq salmış, zəlalət dəryasına qərq olmuşlar və heç vaxt doğru sözə etina etməmişlər. Onlar başqa heç bir insana aid edilməsi layiq olmayan çoxlu qəbahətlər və pis əməllər törətmişlər. Əvvəla, Əbu-Bəkr Allah-taalanın kitabına zidd hərəkət edərək Fatimətüz-Zəhranı – Allahın salamı olsun ona – öz haqlı mülkü olan Fədəkdən*[2033] *məhrum etdi. O, həmin xanımın qəlbini elə azarladı ki, o xanım öz vəsiyyətində Əbu-Bəkrin onun pak cəsədinin üstündə namaz qılmamasını buyurdu. Onun üçün də həmin xanımı gecə ikən dəfn etdilər. Əbu-Bəkr öz xəta söyləyən dili ilə bir dəfə etiraf edib söyləmişdir: "Məni boş verin! Nə qədər ki Əli sizin aranızdadır, sizin ən fəzilətliniz mən deyiləm". Ömər də onunla yoldaş olmasına baxmayaraq, o rəzil haqqında belə demişdir: "Ay camaat! Əbu-Bəkrə beyət tələskən və tədbirsiz bir iş olduğu üçün Allah onun şərini sizdən uzaqlaşdırdı. Bundan sonra kimsə sizdən belə bir şey istəsə, onu öldürün!". Ömərin qəbahətləri və pis əməlləri həddən-hüduddan artıqdır. Belə ki, o, xümsü qadağan etmiş, Zəhranın Əbu-Bəkrlə münaqişəsi vaxtında Fədəklə bağlı yazılmış kitabı cırmış, dəfələrlə öz cəhalətini və qüsurunu etiraf etmişdir. Necə ki demişdir: "Əgər Əli olmasaydı, Ömər həlak olardı". Osmanın da qəbahətləri hədsiz-hesabsızdır. O cümlədən "Quran"ı yandırmış, səhabələrdən olan İbn-Məsudu çubuq zərbəsi ilə həlak etmiş, Əmmar Yasiri elə vurmuşdur ki, onda yırtıq əmələ gəlmişdir. Əbuzər Qəffariyə isə əziyyət verdikdən və açıq-aşkar təhqir etdikdən sonra onun sürgün edilməsinə hökm vermişdi. Ondan o qədər pozğunluq və riyakarlıq baş vermişdir ki, bunların imlası və inşası mümkün deyildir. Axı kim mümkün hesab edə bilər ki, ümmətin camaatı üçün bu cür qəbahətli xüsusiyyətlərə malik belə bir zat məqbul olsun?!*

*Beyt*

*Onun (Həzrət Əlinin) elmi göyün ən yüksək zirvəsinə çatır,*
*Ondan yüksək saydıqlarınızın elmi isə yalançılıqdır.*

*Beləliklə, məlum oldu ki, bu barədə xətalı yazan qələminizlə qeyd etdikləriniz məhz töhmət, iftira və eynən böhtandır. Müsəlman olan kimsə şeytanların məlun əməlləri qarşısında laqeydlik və etinasızlıq göstərməz. Çünki peyğəmbər həzrətləri – ona və nəslinə salam olsun – bu fani dünyadan gözəl cənnətə köçdüyü vaxt buyurmuşdu ki, vəsiyyət etməsi üçün qələm və dəvat gətirsinlər və vəsiyyətini gövhər saçan qələmlə yazıya alsınlar. Lakin o məlunlar həmin zaman elə sözlər söylədilər ki, onların yazılması və hətta anlatılması ədəbsizlikdir. Onlar Bəni-Haşim qəbiləsinin əksəriyyətinin gözləri qarşısında Fatimeyi-Zəhranın – ona salam olsun – evinə od vurdular. Cəmiyyət arasında məşhurdur ki, peyğəmbər həzrətləri – ona və nəslinə salam olsun – buyurmuşdur: "Fatimə mənim bədənimin bir parçasıdır. Onu incidən məni incidər, məni incidən isə Allahı incitmiş olar". Allah-taala buyurur: "Allahı və Onun Peyğəmbərini incidənlərə Allah dünyada və axirətdə lənət eləmişdir"*[2034]*.*

*Əgər siz həmin yanlış yolda qətiyyətlisinizsə, o zaman öz tüğyançı tayfanızın içində Allahdan qorxmayan, inadçı və təkəbbürlü şəxslərdən hər kim etiqadı pozmaqda, küfrü və məkri möhkəmləndirməkdə ən məşhur və ən öncüldürsə, onu göndərin ki, islam məmləkətlərində olan görkəmli alimlər, fəzilətli insanlar və peyğəmbərin – ona salavat və salam olsun – şəriətinin qoruyucuları onların qəlbinə yol tapsınlar və ondan sonra küfr, zəlalət və ədavət səmtini, kin-küdurət və tüğyan yolunu buraxıb iman və islam əhli sırasına daxil*

[2033] Fədək – Mədinə ilə Xeybər arasında, Mədinədən 150 km. aralıda yerləşən Fədək kəndində peyğəmbərə məxsus xurma bağı vardı.
[2034] *Qurani-Kərim, "Əhzab" surəsi, 57-ci ayə.*

*olasınız. Əks təqdirdə, aləmi tutan qılıncımız sizin qəlbinizə yol tapacaq və öz amansız tiyəsinin sığalı ilə şirk və küfr pasını sizin könül səhifənizdən təmizləyəcəkdir. Tezliklə ildırım kimi iti qılıncın şimşəyi o məkruh güruhunuzun cisminin xırmanına düşüb həyatınızı elə yandıracaqdır ki, qiyamət gününə qədər dövranın səhifəsi üzərində o lənətəgəlmiş, qovulmuş və rədd olunmuş camaatınızdan heç bir əsər-əlamət görünməyəcək.*

*Nəzm*

*Sənin Əli ilə ədavətin ki var, ey bədbəxt,*
*Bu, səni xalqın gözündə xar və ağlar edəcəkdir.*
*Heydəri-Kərrara qarşı kin-küdurətdən ürəyin razıdır,*
*Amma sənin bu qəzəbini Yaradan dəf edəcəkdir.*
*Yapışmışsan Yezid soyunun ətəyindən,*
*Bax gör ki, "vilayət"in əli nə edəcəkdir"*[2035].

Bunun ardınca dinin pənahı olan şah onlara (özbək elçilərinə) xələt verib yola saldı. Elə ki elçilər Übeyd xanın yanına getdilər və miqdarı yetmiş min nəfərdən artıq olan [qızılbaş] qoşununun say çoxluğunu ona ərz etdilər, bu səbəbdən Übeyd xan Buxara tərəfə qaçdı. Bu barədə daha öncə məlumat verilmişdir.

Dinin pənahı olan şah köçhaköçlə Herata gəlib səltənət taxtına oturdu. O, həmin diyarın idarəçiliyini doğma qardaşı Bəhram mirzəyə verdi və Qazi xan Təkəlünü o həzrətin lələsi [təyin] etdi. 16 rəbiüləvvəldə (18.11.1529) [Şah Təhmasib] hərəkət bayrağını İraq səmtinə qaldırdı. Herat sakinləri yenə də firqət günəşinin şüaları altında qaldılar və mühacirətin kədərli küləyinə giriftar oldular. Onların xatirləri zəhər dadlı ayrılıq qədəhinin qurtumlanması ucbatından pərişan oldu. Fəza şövkətli ordu Təbəs biyabanına çatdı. Bura elə bir səhra idi  ki, onun heybətindən ulduz asimanda yolunu azırdı və onun qəzasından, bəlasından bələdçi öz canını min hiylə ilə bir kənara çıxara bilirdi. Ordu bu səhraya daxil oldu.

Nəzm

"O biyabanın yolunun sonu yox idi,
Əndişə səhrası kimi idi, ucu-bucağı yox idi.
Orada heç kəs adamdan bir nişan görməmişdi,
Pis niyyətlilər kimi insanlıqdan xali idi.
Könül oradan tez qaçıb uzaqlaşmaq istəyir,
Cahillərin söhbətindən əhli-dilin qaçdığı kimi.
Məhşər səhrası kimi fəlakət və şərlə doludur,
Qulyabanılardan və divlərdən orada yüz sürü vardır.
O diyarda bayquşdan başqa quş yoxdur,
Oranın xuraman qırqovulu uğursuz bayquşdur.
Onun quşu əcəl qartalı kimi can ovlayandır,
Fəna çölü kimi ərazisi qübarla doludur.
Orada su tapacağına ümidini üz,
Orada günəşin isti çeşməsindən başqa [çeşmə] yoxdur".

Yüksək şanlı hökmdar çoxlu qoşunlarla o biyabandan keçib İsfahan şəhərinə daxil oldu.

## Müxtəlif əhvalatlar

Bu il dinin pənahı olan şahın Xorasana getməsindən öncə Qəzvinin Şərifabad[2036] mənzilində Məntəşa sultan və Qazuq sultan kimi ustaclu əmirləri [şahın] ayağını öpmək izzətinə nail olub tam hörmətə layiq görüldülər.

Bu il içində Zinəşin qardaşı Din Məhəmməd min süvari ilə Səbzəvara gəldi. Ağzıvar sultan yüz süvari ilə bərabər onunla döyüşüb onu bir çox özbəklərlə birlikdə qətlə yetirdi və bunların başlarını ali dərgaha göndərdi.

---

[2035] İstifadə etdiyimiz Baroda və Tehran nəşrlərində Şah Təhmasibin Übeyd xana cavab məktubu əksini tapmamışdır. Məktubun mətni Bakı nüsxəsinin 134b-140b vərəqlərindən alınmışdır.

[2036] Bakı nüsxəsi: "Şərəfabad".

Yenə bu il Əmir Qiyasəddin Mənsur ibn Əmir Sədrəddin Məhəmməd sədarət vəzifəsində Əmir Nemətullaya şərik edildi.

**Ölümlər**

Bu il Kuçum xan ibn Əbülxeyr xan ibn Dövlətşeyx-oğlan ibn İlti-oğlan[2037] ibn Fulad-oğlan ibn Aybə Xoca ibn Toğtay[2038] ibn Şeyban ibn Cuci ibn Çingiz xan Səmərqənddə vəfat etdi. Atasından sonra Əbu-Səid onun yerinə xan oldu.

Əmir Qivaməddin Hüseyn İsfahanini qocalıq bürüdüyündən onun qüvvəsi düşkünlük vadisinə üz tutmuşdu və onun işlərində bəzi xətalar baş vermişdi. O cümlədən həmin zaman Mövlana Cəlaləddin Hafiz Təbrizi ilə Mövlana Səədəddin Xətib arasında xitabət mənsəbi üstündə münaqişə olmuşdu. Bu ikisindən[2039] hər biri öz mətləbinin hasil olması üçün [Əmir Qivaməddin Hüseynin yanına] gəlib-getmişdi və o, onların hər birinə xitabət mənsəbinə təyin olunacağı ilə bağlı müjdə və muştuluq vermişdi. Bir gün Mövlana Cəlaləddin yenə də Mirin (Qivaməddin Hüseynin) xidmətinə getmişdi ki, öz müddəaları barəsində bir neçə məsələni ərz etsin. Həzrət Mir onun Mövlana Səədəddin olduğunu zənn etmiş və Mövlana Cəlaləddin söhbətə başlamazdan öncə Mir demişdi:

- Mövlana Cəlaləddinin iddiası mənasızdır. Bu vəzifə sənə layiqdir. Mən hərdən onu bu vəzifəyə təyin olunacağı barədə ümidvar etsəm də, bunu ona görə etmişəm ki, onun bir dəstə himayədarı vardır. Amma sən xatircəm ol ki, mən xitabət [vəzifəsini] Mövlana Cəlaləddinə verməräm.

Mövlana Cəlaləddin Mirin ürəyindəki gizli fikirdən xəbərdar olduqdan sonra bir daha xitabət mənsəbinə təyin olunmaqdan ötrü [onun yanına] gəlib-getmədi.

## 937-Cİ İLDƏ (25.08.1530 – 14.08.1531) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Gəndümana getməsi və şamlularla təkəlülərin döyüşü

Bu il dinin pənahı olan şah Gəndüman yaylağına[2040] hərəkət etdi. Hüseyn xan Şamlu Şirazdan gəlib şahlıq astanasının qarşısında təzim etmək şərəfinə nail oldu və xosrovanə lütfkarlığın və padşahanə hüsn-rəğbətin çoxluğu sayəsində tay-tuşlarından üstün oldu. Çuxa sultan, Hüseyn xana münasibətdə nifaq məqamına gəlib bir məclis[2041] vaxtı onu qətlə yetirmək niyyətinə düşdü. O, bu məqsədlə bir ziyafət tərtib etməklə məşğul oldu ki, ertəsi gün onları (Hüseyn xanı və yaxın adamlarını) qonaq çağırsın. Dinin pənahı olan şahın mülazimlərindən bəziləri [Hüseyn xanı] bu hal-qəziyyədən agah etdilər.

Gecənin qara pərdəsi əyyamın kafurlu səhifəsini gül əndamlı gözəllərin rüxsarındakı xal kimi qara rəngə boyadı.

Nəzm

“Cahan gözəllərin pərişan saçları qədər tünd idi,
O, qara gecədən niqab bağlamışdı üzünə.
Mədəni səfra (öd) yandırdığı kimi cahan yanırdı,
Lakin axırda bu səfra sevdaya çevrildi.
Qəza həmin gecə ulduzların mismarı ilə,
Asimanı hər tərəfdən mismarlamışdı.
Planetlərin hamısı matəmə oturmuşdu,
Onlar sübh Zöhhakının gülən dodağını bağlamışdılar.
Həmin gecə çoxlarının ayağını xar sancdı,
Onların heç biri qütb kimi öz yerində dura bilmədi”.

---

2037 Bakı nüsxəsi: “İni-oğlan”.
2038 Bakı nüsxəsi: “Tolğay”.
2039 Məclis nüsxəsi: “onlardan”.
2040 Gəndüman (Kəndəman, Kündəman) yaylağı – İsfahan yaxınlığındadır.
2041 Məclis nüsxəsi: “bir gecə”.

Hüseyn xan qaniçən şamlulardan və qorxmaz dilavərlərdən ibarət bir dəstə ilə döyüş əsləhəsini geyib Çuxa sultanın çadırı üzərinə gəldi.

“Qəflətən bir dəstə əsgər əllərində döyüş sazı ilə,
Nərə çəkərək şir və pələng kimi yetişdilər.
Başlardan çıxıb getdi qürur yuxusu,
Elə bil ki, məhşər sübhü idi, sur çalınırdı”.

Çuxa sultan onlardan qaçıb özünü dinin pənahı olan şahın divanxanasına çatdırdı. Hüseyn xan onu təqib etdi. Şahın çadırında o iki azğın əmir bir-biriləri ilə mücadilə etdilər. Çarpışma əsnasında azğın şamluların atdıqları iki ox dinin pənahı olan şahın tacına sancıldı.

Zülqədər qorçuları [şahın] keşiyində idilər. Onlar şamlularla müttəfiq oldular. Misir[2042] adlı zülqədər qorçusu Çuxa sultana yara vurub onu öldürdü. Amma təkəlülər onun ölümünü məxfi saxladılar.

Nəzm

“Günəş kimi parlayan qılıncını sıyırdı ki,
Onu amansızca düşmənin başına vursun.
Qəza yuxusundan fitnə oyandı,
Qiyamətin əlaməti göründü”.

Burun sultan Təkəlünün oğlu Hüseyn sultanın düşərgəsi [şahın] ordugahı yaxınlığında idi. O, [təkəlülərə] yardıma gəldi. Həmin gecə şamlular döyüşdə və vuruşda cidd-cəhd və çoxlu səy göstərsələr də, amma qarabəxtlik ucbatından onlar üzüqara olmaqdan savayı digər bir şey əldə edə bilmədilər. Bir sıra qətiyyətli dilavərlər və əzəmətli bahadırlar mərdliklə döyüşdülər. O talesiz güruh öz mətləbinə nail ola bilməyərək, xeyli məyus və pərişan şəkildə, tam xəcalətli bir vəziyyətdə İsfahan şəhərinə tələsdi.

[Şamlu tayfasının] rəna cavanlarından və yaraşıqlı ucaboylularından təxminən üç yüz nəfər əsir düşdü. Təkəlülər onları sübh çağı qətlə yetirdilər. Təkəlü əmirləri Çuxa sultanın böyük oğlu Şahqubadı onun yerinə vəkil etdilər. Amma təkəlü münafiqlərinin qan saçan dil qılıncından ölümcül zəhər qətrələri və öldürücü ox damlaları sıçramaqda idi. O qara ürəklilərin ağızlarından düşmənçilik zəqqumunun nəhrləri axmaqda idi. Onlar bu hadisənin baş verməsindən sonra inadkarlığa başladılar. Zərurət üzündən ustaclu, zülqədər və əfşar kimi digər tayfalar onlara qarşı çıxdılar. Neçə gündən sonra Səhl-Əli imamzadəsi yaxınlığında təkəlülərlə onlar arasında döyüş oldu. Bu əsnada təkəlülərin tərəfdarlarından olan Yançı Qulu[2043] özünü dövlətxanaya saldı ki, dinin pənahı olan şahı təkəlülərin arasına aparsın. [Lakin] o həzrətin (Şah Təhmasibin) buyruğu ilə onu qətlə yetirdilər. Dinin pənahı olan şah o azğın tayfanın qətlinə fərman verdi. Təkəlü əmirləri süvar olub dövlətxananın yanına gəldilər. Qorçular onlara qarşı hərəkətləndilər. Müxaliflər qılınca və nizəyə əl atmadan fərar etdilər və onların çoxu öldürüldü.

Dədə bəy[2044] Qorçubaşı təqdir sərpəncəsinə əsir olub qətlə yetirildi. Bədbəxtlik fəlakəti ucbatından rəzalət və zillət tozu onların səadət çöhrəsinə qondu, bəxt əlindən bədbəxtlik şilləsi yedilər və zəmanənin kasasından zillət zəhəri içdilər. Çöldə və biyabanda yıxılıb-qalxaraq və sərgərdan olaraq, gözlərindən tufanın yaratdığı ləpələr qədər yaş axıdaraq, bikəs və namurad surətdə Kürdüstan yolundan tamam məşəqqətlə keçib Bağdada getdilər. Məhəmməd xan Şərəfəddinoğlu, Quduz sultanı bəzi müxaliflərlə bərabər qətlə yetirib başlarını aləmin pənahı olan şahın dərgahına göndərdi. “Afəti-təkəlü” (“təkəlü müsibəti”) [ifadəsi əbcəd hesabı ilə] bu hadisənin tarixinə müvafiq oldu[2045]. Ali hökmdar Hüseyn xanın ardınca xələt[2046] göndərib onu yanına çağırdı.

**Üləmə Təkəlünün Ruma getməsi haqqında söhbət**

Dinin pənahı olan şahın himayəsinin səadəti altında Azərbaycan vilayətinin hakimiyyətini əlində tutan Üləmə qeyri-mümkün bir sevdaya düşüb, özündə səltənət və istiqlal xəyalına yol verərək Çuxa sultanın

[2042] Məclis nüsxəsi: “Həsən bəy Qoruqluoğlu”.
[2043] Baroda nəşri: “Yəhyaoğlu”.
[2044] Baroda nəşri: “Dura bəy”. Bakı nüsxəsi: “Durqud bəy”.
[2045] “Afəti-təkəlü” = 937 h.
[2046] Məclis nüsxəsi: “dəyərli xələtlər”.

yerinə vəkil olmaq istədi. O, təxminən yeddi min süvari toplayıb dinin pənahı olan şahın dərgahına üz tutdu və Qidar Nəbi[2047] yaxınlığına gəlib dayandı.

Onun nankorluğu və üsyanı [haqqında xəbərlərin] bir qismi [Şah Təhmasibin] izzət və calal qulağına çatdıqda, dinin pənahı olan şah onun üstünə sürətlə yürüdü. Üləmə döyüşdən və qırğından üz çevirdi və cahangir hökmdarın qorxusundan, oxun kamandan uçduğu kimi qaçıb aradan çıxdı, günəş misallı çətirin əzəməti qarşısında kölgə kimi yerə düşdü, göy üzünə ucalan bayrağın ayparasının şövkətindən hilal kimi [rəngi] ağardı və [qəddi] əyildi. O, suya qərq olmuş gözlə və atəşə düşmüş ürəklə özünü Van qalasına saldı. Orada öz yaxınları və qohumları ilə məşvərət etdi. Hamısı belə dedi:

- Çıxış yolu budur ki, hər nə cür olursa olsun, o həzrətin [Şah Təhmasibin] razılığını və könlünü almağa çalışmalıyıq. Çünki padşaha qarşı müxaliflik etməyin axırı əzab və iztirab olacaqdır. Müdriklər demişlər ki, hökmdarlara qarşı çıxmağın sonu bu dünyada rəzil olmaq və axirətdə atəşə düşməkdir.

Bu söz Üləmənin ürəyincə oldu. O, Ürkməz Zülqədəri layiqli peşkəşlərlə və müvafiq töhfələrlə ərşə bənzər dərgaha göndərdi. Amma onu yola saldıqdan sonra başqa bir fikrə düşüb öz-özünə dedi ki, axı mən cəfa toxumu səpdiyim yerdə vəfa xırmanını necə biçə bilərəm və düşmənçilik ağacı əkdiyim halda dostluq meyvəsini nə cür təvəqqe edə bilərəm?!

Misra

"Pislik etdinsə, yaxşılıq gözləmə!"

[Buna görə də] dinin pənahı olan şahın yanına getmək barədə tərəddüd etdi. O əsnada [Üləmə üçün] Rum padşahı Xondgar Süleyman tərəfindən zərlə tikilmiş bir paltar və qızılla işlənmiş bir çalma (mücəvvəzə) gətirdilər. O, xondgarın xələtini geyib Ruma yollandı.

### Özbək əmirlərinin Xorasana basqına getməsi haqqında söhbət

Bu il Qəməş-oğlan, Tinəş bəy və Şeyx Əbu-Səid Əfrasiyab purtavulluq[2048] edərək çayı keçib Sərəxsdən Məşhədə gəldilər. Məntəşa sultan o vaxt o diyarın hakimi idi. O, döyüşməyi məsləhət bilməyib Nişapura gəldi və Ağzıvar xanı da özünə qoşub[2049] rəqiblərin üzərinə yollandı. Özbək əmirləri özlərində onlara qarşı savaşmaq qüvvəsi görmədiklərindən, naçar qalıb fərar etdilər və Siyahab (Qarasu) [çayından] keçdilər. Ağzıvar sultanla Məntəşa sultan o məkanda onlara yetişdilər. Özbəklər çayın digər sahilində mövqe tutub qazilərə ox atmağa başladılar. Özbəklərin bir dəstəsi basqın niyyəti ilə çayın bu sahilinə keçdi. Ağzıvar xan ildırım kimi özünü onlara vurdu və neçə nəfəri qətlə yetirdi. Özbəkləri hədsiz qorxu bürüdü və onlar fərar yolunu tutdular. Yüksək şanlı əmirlər müqəddəs Məşhədə qayıtdılar. O əsnada dinin pənahı olan şahdan bir qorçu gəlib əmirlərin [şahın hüzuruna] gəlmələrini tələb etdi. Onlar ulu dərgaha yollandılar.

### Rumda baş vermiş əhvalatlar haqqında söhbət

Bu il Sultan Hacı Bektaş[2050] övladlarından olan bir qələndər qiyam qaldırdı. Səbəbi bu idi ki, Rum padşahı Sultan Süleyman onu tələb etmək üçün bir çavuş göndərmişdi. Bəng[2051] aləmində olan qələndərlər o biçarəni qətlə yetirdilər. Buna görə də Şah Qələndər naçar müxaliflik etməyə başlayıb, aşağı səviyyəli qələndərlərlə Qeysəriyyə şəhərinə basqın edərək orada öz istila bayrağını yüksəltdi. Həmin vaxt Anadolu əmirülümərası Bəhram paşa, Qaraman paşası və Sivas paşası müqayisəyəgəlməz qoşunlarla xofsuz və qorxusuz bir şəkildə Şah Qələndərlə savaşa gəldilər. Əksəriyyəti üryan olan qələndərlər Rum ordusu bərabərində səf çəkdilər. [Qələndərlər] hiddət və kinlə o böyük qoşunlara həmlə etdilər. Bəhram paşa və digər rumilər bahadırlıqdan dəm vurmalarına baxmayaraq, qaçmağa üz qoydular. Qələndərlər onları təqib edib bir çoxlarını qətlə yetirdilər. Bəhram paşa xeyli məşəqqətlə öz bayrağını aradan çıxara bildi. Elə ki bu möhnətli xəbər Sultan Süleymana çatdı, Bəhram paşa istisna olmaqla [döyüşdə iştirak etmiş] digər əmirləri [cəzalandırmaq üçün onlara] qadın ləçəyi geydirdi. Daha sonra o, vəziri-əzəm olan İbrahim paşanı "qapı xalqı"ndan ibarət çoxsay-

---

2047 Qidar Nəbi – Sultaniyyədən təxm. 25 mil cənub-qərbdə yerləşir *(Seddon, şərhlər, s.262).*

2048 Purnavul (yaxud purtavul) – özbək ordusunun kəşfiyyatçı və qənimətçi dəstələri.

2049 Baroda nəşri: "özünə müttəfiq edib".

2050 Hacı Bektaş (XIII əsr) – Türkiyədə Bektaşilik təriqətinin banisi.

2051 Bəng – uyuşdurucu maddə.

lı ordu ilə [qələndəri] dəf etməyə göndərdi. Adı çəkilən paşa müzəffər qoşunlarla gözlənilməz bir bəla kimi qələndərlərin üstünə gəldi. Onların müqavimət göstərməyə qüvvəti, mətanət nümayiş etdirməyə qüdrəti çatmadı və öz bəxtsizlik üzlərini fərar vadisinə sarı çevirdilər. Dəli Pərvanə onların sərdarı olan Şah Qələndəri qətlə yetirdi. Onun başını dərgaha gətirdilər.

Beyt

“Qeysərə əyilməyən baş,
Xarlıqla yol torpağı üstünə düşdü”[2052].

### Müxtəlif əhvalatlar

Bu il dinin pənahı olan şah əmirülüməralıq mənsəbini Hüseyn bəy Şamluya və Abdulla xan Ustacluya layiq gördü. Onların hər ikisi rəhmətlik şahın (Şah İsmayılın) bacısı oğlu idilər.

Yenə bu il qışlaq Təbrizdə oldu. Orada Üləmənin yanından gəlmiş olan Ürkməz bəy Zülqədər yandırıldı.

Bu il bu sətirlərin müəllifi Həsən Rumlu Qum şəhərində anadan oldu.

### Ölümlər

Babur padşah ibn Öməşeyx ibn Sultan Əbu-Səid ibn Mirzə Sultan Məhəmməd ibn Mirzə Miranşah ibn Sahibqiran Əmir Teymur Kürəkan. O həzrət himmətinin aliliyi, dərəcəsinin yüksəkliyi, ağlının, fərasətinin, fəhminin və müdrikliyinin kamilliyi ilə Əmir Teymur Kürəkanın xanədanına mənsub sultanların öndəgedəni idi. Hər il on yeddi min[2053] Təbriz tüməninə bərabər məbləği soyurğal şəklində ləyaqət sahiblərinə paylayırdı. Hər hansı bir tərəfdən onun yanına gələn hər kəs, istər möhtac olsun, istər zəngin olsun, istər alim olsun, istər cahil olsun, istər qabil olsun, istər qeyri-qabil olsun, muradına və məqsədinə nail olaraq geri qayıdırdı.

Ömrünün müddəti qırx doqquz il və səltənət əyyamı otuz səkkiz ildir. Padşahlığının əvvəllərində məmləkəti Fərqanə və Səmərqənd vilayəti idi. Mavəraünnəhr əlindən çıxdıqdan sonra Qəndəhar, Aqra, Lahor, Kabil, Dehli və Bədəxşan vilayəti ixtiyarında idi. Aqrada vəfat etmişdir. Hümayun padşah[2054] onun yerinə səltənət taxtına əyləşdi.

Elə ki Babur padşahın vəfat xəbəri Məhəmməd Zaman mirzəyə çatdı, cahil adamların təhriki ilə istiqlal iddiası onun könlündə yer tapdı. Bu səbəbdən səadətli padşah [Hümayun] çoxlu qoşun toplayıb, onun düşərgəsinin yerləşdiyi Qanq çayı kənarına gedərək Məhəmməd Zaman mirzəni döyüşsüz ələ keçirdi və qalalardan birində məhbus etdi. Bir müddət sonra o, həbsdən fərar edib bir neçə nəfərdən ibarət məhdud dəstə ilə sərgərdan və avara oldu. Axırda xeyli çarəsizlik və peşmançılıq üzündən ali mənşəli hökmdarın (Hümayun padşahın) yanına gəldi və ehtirama layiq görüldü.

## 938-Cİ İLDƏ (15.08.1531 – 02.08.1532) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Üləmə Ruma getdikdə Sultan Süleymanı təşviq etdi ki, dinin pənahı olan şahla düşmənçilik etsin. Buna görə də [Sultan Süleyman] Fil paşanı əlli min süvari ilə Üləməyə yoldaş edib onları Bitlis hakimi Şərəf xan Kürdün üzərinə göndərdi ki, o diyarı onun əlindən alsın. Bu xəbər o vilayətdə yayıldı. Şərəf xan öz oğlu Şəmsəddin xanı Bitlisdə qoyub aləmin pənahı olan dərgaha yollandı.

Nəzm

“O tərəfdən Üləmə qalxıb Rumdan gəldi,
Özü ilə hər diyardan qoşun gətirdi.
Bitlisi əhatəyə aldılar onlar,
Qalanın ətrafında oturdular o zaman”.

---

[2052] Şah Qələndər və ya Qələndəroğlu üsyanı 1527-ci ildə baş vermişdir (bax: *J.V.Hammer. Osmanlı tarihi. İstanbul, 1991, I. c., s.455*).
[2053] Bakı nüsxəsi: “on səkkiz min”.
[2054] Hümayun padşah – Böyük Moğollar sülaləsindən olan Hindistan hökmdarı (1530-1556), Zəhirəddin Məhəmməd Baburun oğlu.

Bu tərəfdən dinin pənahı olan şah tərtibə salınmış ordu ilə və növrəstə cavanlarla birlikdə qəzəbli aslan və qorxunc bəbir kimi onların üzərinə hərəkətə gəldi. Elə ki o həzrətin irəliləməsinin avazı rumilərin qulaqlarına çatdı, onları dəhşət və heyrət bürüdü. Onların bəxtlərinin ulduzu söndü, səadətlərinin kosu isə başı aşağı düşdü. Onlar Bitlisi zəbt etməkdən ümidlərini üzdülər. Toplarını orada qoyub qaçış yolunu tutdular. Dəli Yadigar Ruzəki[2055] rumilərin fərarının xəbərini Qaranqu-dərədə[2056] şahın ərzinə çatdırdı. O həzrət geri qayıdıb o il Təbrizdə qışlaq etdi.

**Übeyd xan Özbəyin Bəhram mirzəni Heratda mühasirə etməsi və aləmin pənahı olan şahın onun yardımına gəlməsi haqqında söhbət**

Bu ilin 29 ramazanında (05.05.1532) Übeyd xan dövran hadisələrindən daha artıq sayda qoşunlarla Heratın ətrafını əhatəyə aldı. O, Şaymaneyi-Şamyanə kəndində[2057] özünə bargah qurdu. İzzətliləri zillət torpağına oturtdu. İlk öncə dodağı qurumuş fəqirləri və ümumən sakinləri su mənbəyindən məhrum etdi. Zalım özbəkləri yollarda növbə çəkməyə təyin etdi ki, yemək cinsindən heç bir şey qalaya getməsin. Bu səbəbdən Heratda mühasirədə qalmışların ruh düşkünlüyü və təşvişi günbəgün artdı. O əsnada Qazi xan möhtac adamların [şəhərdən] çıxarılmasına hökm verdi. O, [şəhəri tərk edən] sakinlərin mallarının təhqiqi üçün darvazaları və keçiş yollarını hər biri Nəmrud və Şəddada[2058] tay olan sərt və güclü türklərə tapşırdı. Onlar şəhəri tərk edən sakinlərin köhnə balışlarını və yorğanlarını cırıb içini axtarırdılar ki, məbada bunların içində nağd [pul] və cins [mal] kimi nə isə ola bilər. Bu təhqiqatdan sonra bir qadın və bir kişidən ibarət hər ailədən üç yüz[2059] Təbriz dinarı alıb onları [şəhərdən] çıxarırdılar. Şəhər o dərəcədə boşalmışdı ki, bazarlarda heç bir kəs gözə dəymirdi. Buna baxmayaraq, qazilərin bir çoxları Qazi xandan üz döndərib Übeyd xanın yanına getdilər. Übeyd xan qazilərin Qazi xandan fərar edib onun yanına gəlmələrini təmin etmək məqsədilə onlara nəvaziş göstərib xələt verirdi.

O vaxt Übeyd xan bir qitə deyib, bunu Qazi xanın vəziri olan Xoca Əmir bəy Mehrə göndərdi. Xoca da onun cavabında beytlər yolladı.

*Übeyd xanın şeiri*

*"Ey külək, əgər Xorasan əhlinə rast gəlsən,*
*Mütləq çatdırarsan onlara sifarişimizi.*
*Lütf üzündən o güruha deyərsən ki,*
*Sizə qarşı kinliyik bizim hamımız.*
*Çünki sizin qürur qürur və cahillik qələminiz,*
*Bizim adımıza bir məktub yazıb.*
*Ey Xoca, bundan belə yaşamaqdan ümidi üz,*
*O səbəbdən ki, xanlıq sikkəsi vurulubdur adımıza"*[2060].

Xoca Əmir bəyin cavabı:

"Ey külək, əgər Buxara əhlinə rast gəlsən,
Mütləq ərz edərsən onlara ismarışımızı.
O zaman kərəm yolu ilə o güruha deyərsən ki,
Bizim hamımızın sizə kin-küdurəti vardır.
Çünki sizin cəhalət və qürur qələminiz,
Bizim adımıza belə bir rüqə yazmışdır:
"Ey Xoca, bundan belə yaşamaqdan ümidi üz,
O səbəbdən ki, xanlıq sikkəsi vurulubdur adımıza".
Ey boşboğaz, məgər sən eşitməmişsənmi ki,

---

2055 Nuruosmaniyyə nüsxəsi: "Rucəki"; Məclis nüsxəsi: "Div Yadigar oğlu".
2056 Qaranqu-dərə - Xoy yaxınlığındadır *(Seddon, şərhlər, s.263).*
2057 Baroda nəşri: "Şamyanə kəndində". Bakı nüsxəsi: "Şaymanə kəndində".
2058 Nəmrud və Şaddad – dini mətnlərə görə, qədim dövrün qəzəbli və amansız hökmdarları.
2059 Məclis, Nuruosmaniyyə və Bakı nüsxələri: "yüz əlli".
2060 Bakı nüsxəsi (143a).

Gəlib çatmaqdadır ulduzlar qədər ordusu və
asiman kimi həşəməti olan şahımız.
Biz həzrət şahın bəndələriyik və əzəldən,
Qeyd olub varlıq dəftərində davamımız.
Bizim nizamımızın silkində və intizamımızın silsiləsində,
Hər nə var isə onun inayətinin parıltısındandır.
Sənin etdiyin xanlıq iddiasına cavab olsun,
Bu bir beyt şirin kəlamlı Hafizimizdən[2061]:
"Elə olur qaş-göz etməyi və nazı düz qamətli gözəllərin ki,
Gəlir cilvəyə bizim şən sərvi-sənubərimiz"[2062].

Bu əsnada Qazi xan hökm etdi ki, qızılbaşlar şəhərdən çıxarılmış adamların evlərinə getsinlər və hər nə tapsalar, ələ keçirsinlər. Mühasirədəki qazilər və insafdan, mürüvvətdən uzaq türkmanlar[2063] hakimdən bu sözü eşidən kimi rəiyyətin mənzillərinə soxuldular və axtarışa başladılar. Adamların dəfn etdikləri (gizlətdikləri) şeyləri ələ keçirdilər. O əsnada aclıq atəşi yayıldı və neçə ay ərzində, hər gecə və sübh çağı fələklərin təndirindən çıxan günəşlə ayın dəyirmi görünüşündən savayı, qazilərin və şəhərlilərin gözü girdə heç nə görmədi[2064].

Nəzm

"İnsanlar aləmdə ümidlərini girdə çörəyə dikmişdilər,
Lakin ayla günəşin girdəsindən başqa girdə şey görə bilmirdilər.
Qarınlar kimi qazanların da içi yeməkdən xali idi,
Fələyin tası kimi sübh və şam başı aşağı idi.
Tabağa zillənmişdi iştahanın ümid gözü,
Fəqət tabaqlar kağız kimi ağ qalmışdı.
Aləm təamsızlıqdan səbatsız olmuşdu,
Ac qarın həyatın acı sarımsağını yemişdi.
Bir gün (bir zamanlar) taxıl dənəsi ilə yoldaşlıq etdiyi üçün,
Samanın qiyməti zəfəranın qiymətindən baha idi.
Baş ağrısının təndiri alışmışdı,
İniltidən ciyər od tutub yanırdı".

Ət və yağ, gecəni işıqlandıran gövhər kimi və ənqa quşu kimi nadir və tapılmaz olmuşdu. Möhtac adamların bəziləri ət əvəzinə pişik və it əti ilə qidalanırdılar. Bəziləri isə köhnə dərini çeynəyib yeyirdilər. [Bəhram] mirzə və əsilzadələr ağac yarpaqlarını, ulaq yemini yeyirdilər. Bəzi özbəklər Übeyd xandan gizlicə darvazanın yanına gələrək, arıq atlarını oraya gətirib onları tam baha qiymətə [qızılbaşlara] satırdılar və əgər bu alqı-satqı olmasaydı, qazilərin işi çətin olardı. Mühasirə müddətinin axırında qazilər elə qüvvətsiz olmuşdular ki, əsa ilə yeriyirdilər. Bəhram mirzənin bavərçisi (aşpazı) həqir bir tabağa[2065] düyü və ət töküb həmin tabağı neçə-neçə boş tabaqlarla birlikdə o həzrətin yanına gətirirdi. [Bəhram] mirzə lütf etdiyi kəslərin tabağına bir qaşıq düyü tökürdü. Halbuki bu tabaqların hər birinin həcmi üç-dörd batman düyü və ət tutardı. İş o yerə çatmışdı ki, [Bəhram] mirzənin məclisində bir qaşıq düyüdən ötrü dava düşürdü.

Bəhram mirzədən nəql edirlər ki, bir gün Qazi xanla oturduqları zaman iki nəfər mötəbər ağa divana gəldi. Onların biri tuğaçı idi, digəri isə tərxan (əmir) idi. Onlardan biri dedi:

- Neçə gün əvvəl bir köpəyi qılıncla vurmuşam və o it bu kişinin evinə gedib. Lakin o indi bu iti mənə vermir.

Digəri isə cavabında dedi:

- Evimə gəldiyi vaxt bu it yaralı idi, amma ölməmişdi. O, məhz mənim zərbəmdən sonra düşüb öldü.

---

[2061] Hafiz Şirazi – XIV əsrin məşhur İran şairi.
[2062] Xoca Əmir bəyin Übeyd xanın cavabında yazdığı bu şeirdəki son beyt olduqca təhqiramiz sətiraltı mənaya malikdir.
[2063] Bakı nüsxəsi: "türklər".
[2064] Bu cümlədə mühasirəyə alınmış Herat şəhərində çörəyin tapılmadığına işarə edilmişdir.
[2065] Baroda nəşri: "Bəhram mirzənin aşpazı məxfi şəkildə bir tabağa..."

Qazi xan ayağa qalxdı və mübahisəyə son qoymaq üçün iti iki parça edib hər parasını onlardan birinə verdi.

Bu zaman Übeyd xanın yardımına Bəlx valisi Kəskən Qara sultan ibn Canibəy sultan gəldi. Lakin o, Herat ətrafında mövqe tutub qızılbaşlarla dostluq münasibəti yaratdı və Bəhram mirzə üçün bir südəmər quzu və at [südündən hazırlanmış] kərə yağı göndərdi. Onun mülazimləri atlar gətirib qazilərə satdılar. Übeyd xanın tərəfindən elçilər gəlib sülhdən söz saldılar. [Bəhram] mirzə və Qazi xan dedilər:

- Übeyd xan iki mənzil köç edib geri çəkilsin ki, biz şəhəri tərk edib İraqa yollanaq.

Übeyd xan dedi:

- Onlar gəlib mənim çadırımın kəndiri altından keçsinlər və salamatlıqla çıxıb getsinlər.

Lakin Qazi xan [bunu] qəbul etmədi. Bir neçə gün sonra Səmərqənd padşahı Əbu-Səid xanın atalığı gəldi və sülh haqqında söz açdı. Amma bunun da bir faydası olmadı.

Təhlükəli mühasirə müddəti il yarım idi ki davam edirdi. Aclıq və qəhətlik qafiləsi Herat şəhərində məskən salmışdı, şənlik qeybə çəkilmişdi. Həyatdan zövq alan insanların yaşayış imkanları gözəllərin ağızları kimi daralmışdı və firavanlığın olmaması səbəbindən yaraşıqlı nazəninlərin şirin dodaqları təbəssümdən məhrum olmuşdu. Herat əhalisinin daxilindən çıxan fəryad səmanın təbəqələrini yarıb keçirdi. Elə bu zaman ətirli sevinc yeli Herat giriftarlarının ümid tarlasına əsdi və aləm sakinlərinin padşahının Xorasan vilayətinə gəlişinin xəbəri rəqib ordusunda yayıldı. 939-cu ilin rəbiüləvvəl ayının 14-də (14.10.1532) Übeyd xan Heratın ətrafından fərar etdi[2066]. Dinin pənahı olan şahın yürüşü haqqında tezliklə məlumat veriləcəkdir.

### Qazilərin özbəklərlə müharibəsi

Bu il özbək bahadırlarının bir dəstəsi Bistam vilayətinə basqına gəldi. Damğan hakimi olan Zülqədər sultan[2067] özbəklərin gəlişindən xəbərdar olduqda, gəraylı[2068] ulusunun yanına adam göndərib yardım istədi.

Nəzm

"Həmin dəm şöhrətli qəhrəman Zülqədər,
Gəraylılar tərəfə göndərdi xəbər.
Şücaətlə sərəfraz olmuş Mirzə Əli,
Lap mübarək sultan Şah Əli kimi,
Dağa bənzər bir qoşunla irəli atıldı,
İgidlərin yürüşündən zəmin lərzəyə gəldi".

Onlar Zülqədər sultana qoşulub düşmənlərin üzərinə yollandılar. Bistam ətrafında müzəffər əsgərlər özbəklərə çatdılar və onların yolunu kəsib həmlə etdilər. Onlar da [qaziləri] ox yağışına tutdular. Axırda bədbəxtlik küləyi səadətsiz özbəklərin bayrağına əsdi. Onların şövkət ələmi aşağı endi. Həmin günlərdə Qara Heydər qılınc zərbəsi ilə bir çoxlarını qətlə yetirdi. Qazilər düşməni təqib edib, neçə nəfəri əsir tutaraq aləmin pənahı olan dərgaha göndərdilər.

### Müxtəlif əhvalatlar

Bu il Mir Qiyasəddin Mənsuru sədarətdən çıxarıb Əmir Müizzəddin Məhəmməd İsfahanini onun yerinə təyin etdilər.

Yenə bu il ali divanın vəzirliyi Əhməd bəy Nurkamala verildi. Dinin pənahı olan şahın vəziri Əmir Qivaməddin Cəfər Savəci, Nikpey[2069] ribatında qətlə yetirildi[2070].

---

[2066] Fəslin başlanğıcında verilən məlumatdan belə məlum olur ki, Übeyd xan 1532-ci ilin may ayında Heratı mühasirəyə almışdır. Lakin son abzasda mühasirənin bir il yarım davam etdiyi və 1532-ci ilin oktyabrında bitdiyi qeyd olunur. Əgər bu abzasdakı faktlar doğrudursa, Übeyd xanın Heratı 1531-ci ilin mayında mühasirəyə alması ehtimal daxilindədir.

[2067] Ç.N.Seddon *(Şərhlər, s.263)* bu əmirin Əlaüddövlə bəyin nəvəsi və Şahrux bəyin oğlu Məhəmməd xan Zülqədəroğlu olduğunu güman edir.

[2068] Gəraylı – Astarabad vilayətində yaşayan türk tayfası *(V.F.Minorsky. "Tadhkirat al-Muluk", p.170).*

[2069] Nikpey – Zəncan yaxınlığındadır.

[2070] Bu abzas Məclis nüsxəsində "Ölümlər" başlığı altında verilmişdir.

## 939-CU İLDƏ (03.08.1532 – 22.07.1533) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Aləmin pənahı olan şahın Əlqası Astarabad hakimliyinə göndərməsi

Bu ilin əvvəllərində, şabanın 14-də (11.03.1533) Qəməş-oğlan Özbək Savuxbulağın Məxmur çəmənində olan Məhəmməd xan Zülqədəroğlunun ordugahı üzərinə basqın edib, onun yüklərini və mallarını qarət edərək apardı.

Həmçinin bu il dinin pənahı olan şah, Əlqasa hüsn-rəğbət göstərib onu Bədir xanla birlikdə Astarabada yolladı. Elə ki Əlqas Bistama çatdı, öz-özünə qərar verdi ki, qəflətən Astarabad tərəfə sürətlə yürüsün və qiyamət qoparan dəlicəsinə bir həmlə ilə özbəklərin səadət fidanını kökündən qoparsın. O, ordu sərdarlarını canəqi[2071] məclisində əyləşdirib öz könlündəki niyyəti zahir etdi. Orada iştirak edən camaatın hamısı bu fikrə əhsən dedi. Bədir xan və Əlqas min beş yüz süvari ilə gecə yarısı Astarabad səmtinə sürətlə yürüdülər.

Nəzm

“Ulduz zülmətdə elə oğrun-oğrun gizlənmişdi ki,
Elə bil, lap qırla dolu kuzənin içinə düşmüşdü.
Qaranlıq, cahanı özünə elə əsir etmişdi ki,
Fələk heyrətdən qütb kimi öz yerində donub qalmışdı”.

Onlar elə bir vaxtda Astarabada çatdılar ki, göy üzü sübh qızartısından bəzək tapmış, günəş şəfəqləri gecəni işıqlandıran gövhərlər kimi səmanın mavi qutusundan ətrafa saçılmağa başlamışdı. Həmin zaman özbəklərin əksəriyyəti hamamda idi. Qazilər hiddətli bir şəkildə şəhərə daxil oldular, şeypur çaldılar və nağara vurdular. Özbəklər çılpaq və üryan halda hamamdan çıxdılar. Zəfər nişanlı əsgərlər onları tutub qətlə yetirdilər. Qəməş-oğlan bu hadisə ucbatından heyran və sərgərdan bir halda şəhərin içində vurnuxurdu. Xeyli məşəqqətdən sonra o, beş süvari ilə birlikdə qalanın dar keçidindən xilas olub Mərvə yollandı. qazilər onun dörd qardaşı ilə birlikdə beş yüz nəfəri tutub gətirdilər və başlarını ali dərgaha göndərdilər. Əlqas mirzə və Bədir xan Astarabadda məskən saldılar.

### Dinin pənahı olan şahın üçüncü dəfə Xorasana qoşun çəkməyi və Übeyd xanın fərar etməyi

Elə ki özbəklərin istilası və tüğyanı, Səfəviyyə xanədanının qulamlarının mühasirədə qalmasının müddəti həddən aşdı, dinin pənahı olan şah Xorasan tərəfə hərəkət etdi. Kərəc zaviyəsi[2072] günəş misallı bayraqların şəfəqləri üzündən asiman fəzası kimi nurani olduqda Sufiyan xəlifə Rumlu iki yüz süvari ilə Səbzəvar istiqamətində hərəkətə gəldi. Həmin vaxt Xangəldi Özbək dörd yüz süvari ilə Səbzəvarda idi. Sufiyan xəlifə onun üzərinə gecə basqını edib onun mülazimlərindən əlli[2073] nəfəri qətlə yetirdi. Xangəldi qaçıb aradan çıxdı. Sufiyan xəlifə Nişapura yollandı və həmin şəhərdə də özünü özbəklərə yetirərək onları da məğlub etdi. Daha sonra isə hərəkət bayrağını Məşhəd tərəfə qaldırdı.

Həmin vaxt Əbdüləziz sultan səkkiz min süvari ilə o diyarda idi. O əsnada Hüseyn xan Şamlu, Ağzıvar xan Şamlu və Əmir sultan Rumlu dinin pənahı olan şahdan ayrılaraq Sufiyan xəlifə Rumlunun yardımına yetişdilər. Əbdüləziz sultan Herat tərəfə qaçdı. Daha öncə qeyd edildiyi kimi, Übeyd xan da oradan fərar etdi. Qeyd edilən ilin cəmadiyüləvvəl ayının 22-də (20.12.1532) dinin pənahı olan şah Herata təşrif gətirdi və şəhər bağında səadət və hökmranlıq kürsüsünə əyləşdi. Böyüklər və əyan-əşrəflər [onun] ayağını öpmək xoşbəxtliyinə nail oldular və xosrovanə iltifatla, padşahanə inayətlə şərəfləndilər. O zaman [Şah Təhmasib] rəiyyətin vəziyyətinin qayğısına qaldı, mühasirə müddətində məzlumların mallarını qəsb etmiş olan Qazi xanı və onun tabeçilərini məzəmmət etdi və acizlərdən bəzilərinə xəzinədən [vəsait ödəməklə] nəvaziş göstərdi[2074]. [Şah Təhmasib] Hüseyn xanı, Məntəşa sultanı və Əmir sultan Rumlunu Qərcistanı zəbt etməyə göndərdi. Əmirlər o diyarı fəth edib ali taxtın ətəyinə qayıtdılar.

---

[2071] Canəqi – məşvərət məclisi.
[2072] Kərəc zaviyəsi – Qəzvindən şərqdə yerləşir. Ç.N.Seddon *(Şərhlər, s.263)* bu adı “Kərx” kimi oxumuşdur.
[2073] Məclis nüsxəsi və Baroda nəşri: “yüz əlli”.
[2074] Məclis nüsxəsi: “... məzəmmət etdi və bəzilərinə dövlət xəzinəsindən [zərərin] əvəzini verdilər”.

## Müxtəlif əhvalatlar

Bu il Üləmə Bitlisin üzərinə gəldi. Hüseyn xan Çota, Qılıc bəy Pazuki və b. Kürdüstan əmirləri ilə ittifaqda olan Şərəf xan, Zəriqi[2075] mövqeyində [Üləməyə] qarşı çətin bir döyüş apardı. Onlar rəqibə güclü müqavimət göstərdiər. Amma [axırda] Şərəf xan qətlə yetirildi və Üləmə Bitlisi zəbt etdi.

Bu il içində dinin pənahı olan şah bütün günahlardan tövbə etdi. Hökmdar şanlı bir fərman verdi ki, möhtəsiblər sonu əzab olan [şərab] piyaləsinin və camının abrını töküb onların namus şüşəsini əfsus daşına vursunlar və sürahinin qulağından pambığı çıxarıb "həqiqət acı olur" deyimini ona yetirsinlər. Əgər dikbaşlıq edərsə, onun boynunu üzsünlər. "Kefləndirən hər şey haramdır" hökmünə əsasən, pivə, bəng və [buna bənzər] hər nə görsələr, məhv etsinlər. Şəriət qanununa zidd şəkildə avaz edən, mənasız mahnılar oxuyan müğənniyə cəza yarası vuraraq onun ürəyindən fəryad çıxarsınlar. Hər kimdə utanmaz çəng [alətini] görərlərsə, simlərini kəssinlər. Əgər ney [aləti] şəriətin ahənginə xilaf rəftar edərsə, nəfəsini çıxarmağa imkan verməsinlər. Yöndəmsiz səslər çıxaran anlamsız tənburu elə vursunlar ki, odun kimi alışıb yansın. Hansı məclisdə xoş avazlı rübabı görərlərsə, onu bir eşşəyə oturdub oradan xaric etsinlər. Qumarxanalardan, şərəbxanalardan və pozğunluq yuvalarından hasil edilən külli məbləği isə dəftərlərdən silib atsınlar[2076].

Bu il içində dinin pənahı olan şah Herat əmirliyini Sam mirzəyə tapşırdı və Ağzıvar xan Şamlunu onun lələsi [təyin] etdi.

Bu il içində dinin pənahı olan şah Bəlx üzərinə yürüş etmək məqsədi ilə zilhiccə[2077] ayının 11-də (04.07.1533) Heratdan çıxıb təxminən qırx gün Üləngi-Nişində dayandı.

## Ölümlər

Əbu Səid xan ibn Kuçum xan ibn Əbülxeyr xan Səmərqənddə vəfat etdi və qardaşı Əbdüllətif xan onun yerinə əyləşdi.

## 940-CI İLDƏ (23.07.1533 – 12.07.1534) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Sultan Süleymanın birinci dəfə Azərbaycana qoşun çəkməyi

Bu il Rum padşahı Sultan Süleyman Azərbaycana hərəkət etdi. Onun bu tərəfə qoşun çəkməyinin səbəbi o idi ki, Üləmə Rum hökmdarının dərgahına bir-birinin ardınca elçilər göndərib [bu məzmunda] xəbər çatdırmışdı: "Dinin pənahı olan şah (Təhmasib) Mavəraünnəhrə yürüş etmək məqsədi ilə Heratdan çıxmışdır və Azərbaycandan uzaq düşmüşdür. Əgər padşah (Sultan Süleyman) bu səmtə gələrsə, onun bu diyarı ələ keçirməsi mümkündür". Xondgar, Üləmənin sözünü qəbul edib savaş əşyalarının tərtib olunmasına və döyüş ləvazimatının təkmil edilməsinə dair göstəriş verdi və qantökən bir ordu ilə Təbriz istiqamətində hərəkətə gəldi. O, vəziri-əzəm İbrahim paşanı doxsan min süvari ilə mənqəlay [təyin] etdi. İbrahim paşa isə Üləməni on min[2078] nəfərlə irəli göndərdi. O vaxt Musa sultanın[2079] vəziri olan Xoca Şahqulu, Mövlana Əhməd Təbəsi ilə birlikdə rumilərin yanına elçilər göndərdi və onları Təbrizə gəlməyə dəvət etdi. O satqınlar Üləmə ilə qərarlaşdılar və təmənna qələmi ilə öz xəyal lövhələrinə yalan surətini əks etdirdilər. Bu səbəbdən onlar söz yaydılar ki, Pirə Sinan oğlu sabah şəhərə gələcəkdir. Qazilər və şəhərlilər qarşılama mərasiminə tələsdilər. Üləmə və Rum ordusunun digər sərdarları şəhərə daxil oldular. Bir neçə gün sonra İbrahim paşa cəmi əmirlərlə Təbriz ətrafına gəlib Üləməni Ərdəbil tərəfə yolladı və Xosrov paşanı Əlincəq qalasını zəbt etməyə göndərdi. Xülasə, [rumilər] Azərbaycanın əksər şəhərlərini tutdular.

Nəzm

"Xoş tutdular həriflər saqinin zülfünün ucunu,
Fələkləri qoyarmı ki, bir qərar tutsunlar?!"

---

[2075] Zəriqi – XVII əsrdə Van əyalətinə bağlı bir sancaq idi *(T.Sezen. Osmanlı yer adları. Ankara, 2006, s.536).*

[2076] Bu abzasda Şah Təhmasibin şəriətə zidd əməllərə qarşı mübarizəyə dair verdiyi fərman obrazlı şəkildə təsvir edilmişdir. Bu fərman haqqında həmçinin bax: *İsgəndər bəy Münşi. Tarixi-aləmarayi-Abbasi. I c. Bakı, 2009, s.274,390.*

[2077] Baroda nəşrində "zilqədə" yazılmışdır *(A Chronicle, t. II, p.113)*.

[2078] Məclis nüsxəsi: "iki min".

[2079] İsa bəy Mosullunun oğlu Musa sultan həmin zaman Azərbaycan hakimi idi *(Seddon, şərhlər, s.264).*

Bir müddət sonra xəbər gəldi ki, dinin pənahı olan şah öz məiyyəti və ordusu ilə Xorasandan köçha-köçlə Təbrizə doğru hərəkət etməkdədir. Bu xəbəri eşitdikdə İbrahim paşa vahiməyə düşüb, təfəkkür başını düşüncə cibinin içinə soxaraq bir anda heyrət dənizinə daldı. Onun fikri pərişanlıq dalğalarının təlatümündə qərq oldu və peşmançılıq qoşunlarının zərbəsinə tuş gəldi, iztiraba düçar oldu. Sultan Süleymana bir ərizə göndərdi. Məzmunu belə idi: "Musa sultan bəndələrinizin yürüşünü eşidən kimi Təbrizi tərk edib İraqa getmişdir. Amma dinin pənahı olan şah yetərincə əzəmət və həşəmətlə Xorasandan Reyə gəlmişdir. Bizim o həzrətə müqavimət göstərmək taqətimiz yoxdur".

Nəzm

"Şahdan başqa heç kəs şahla savaşa bilməz,
Dağdan başqa heç bir daş dərya ilə baş-başa gələ bilməz.
Şah qarşısında nökərlərin taqəti yoxdur,
Çünki ulduzlar günəş qarşısında özlərini itirərlər.
Ümman dənizinin coşduğu zaman,
Ney nə qədər coşsa da, eşidilməz.
Əgər onunla vuruşmağa sən özün gəlsən,
Meydanda yalnız sən ona bərabər ola bilərsən.
Elə ki Rum sultanı bu xəbəri eşitdi,
Onun əndişə camı təlx oldu".

Sultan Süleyman ərizənin məzmununa vaqif olduqdan sonra Təbriz yürüşünü başlıca məqsəd kimi qarşıya qoyub bütün ordu ilə yola düşdü və İbrahim paşaya qoşuldu. Onlar birlikdə İraqa yollandılar.

Rumilərin Azərbaycana gəlişi xəbəri Üləngi-Nişin mövqeyində taxtda əyləşmiş padşaha çatdıqda düşmənləri dəf etmək əzmi ilə köç [etməyi] buyurdu[2080]. İyirmi bir köç mənzili keçib Kəbud-Günbədə gəldilər. Atların və qatırların çoxu tələf olmuşdu. Ağıl və bilik sahibləri və savaş meydanının süvariləri təfəkkür və heyrət məqamına düşdülər. Hər kəsin başında bir xəyal və qəlbində bir əndişə peyda oldu. Çünki Sultan Süleyman səhralıqdan daha geniş və xəzan yarpaqlarından daha artıq sayda bir ordu ilə gəlmişdi. Qalibiyyətli [qızılbaş] qoşunları isə uzaq yoldan sürətlə gəlmiş, onların atları arıqlamış və zəifləmiş, əksər qoşun pərakəndə vəziyyətə düşmüşdü. Belə ki, ali taxtın ətəyində yeddi mindən artıq adam qalmamışdı. Bununla yanaşı, Qazi xan Təkəlü çox əmirlərlə birlikdə dönük çıxmaq niyyətinə düşüb nifaq məqamına gəlmişdi. Amma qüdrətli dövlətin gücü ilə külli işlərin və müşkül hadisələrin asan yolla öz həllini tapdığını dəfələrlə müşahidə etmiş camaatın könlünə heç bir narahatlıq yol tapmamışdı. [Şah Təhmasib] Kərə [adlı] mənzildən[2081] Bəhram mirzəni, Əlqas mirzəni, Hüseyn xan Şamlunu, Əmir sultan Rumlunu, Qazi xan Təkəlünü və Süleyman sultan Rumlunu mənqəlay şəklində Təbriz üzərinə yolladı və fələk şövkətli ordu Qəzvinə gəldi. Qəzvindən isə Əbhərə yola düşdülər. Orada əmirlərdən xəbər gəldi ki, xondgar dəqiq şəkildə [bu tərəfə] gəlməkdədir. Əmirlər xondgar ordusuna qarşı üz qoydular. Onlar Qaraağaca[2082] çatdıqda İbrahim paşa ilə qarşılaşdılar. Döyüş başladı. Rumilərin sayı həddən və hüduddan artıq olduğundan əmirlərin bəziləri, məsələn, Hüseyn xan, Qazi xan və Məlik bəy Xoyi, dönük çıxmaq fikrinə düşmüşdülər. Buna görə də şiddətli bir döyüş baş vermədi. Bəhram mirzə, Əmir sultan və Süleyman sultan gecəyə qədər [rumilərə] müqavimət göstərdilər.

Dinin pənahı olan şah əmirlərin [rumilərlə] qarşılaşdıqlarını eşitdikdə adlı-sanlı bahadırların bir dəstəsi ilə sürətlə yola düşdü ki, təmkinli və vüqarlı bir şəkildə düşməni dəf etməklə məşğul olsun. O əsnada Zülqədəroğlu Məhəmməd xan fitrətinin[2083] mərkəz nöqtəsi və xilqətinin sirri olan zatının xəbisliyini və qəbahətini zahir edib, öz atası Kor Şahruxun qətlindən bəri xatirində saxladığı ədavət səbəbindən Qaya sultanla və Burun sultan Təkəlünün oğlu Hüseyn sultanla birlikdə dövlətə arxa çevirib ali məiyyətə dönük çıxdı. Bu baxımdan müzəffər əsgərlərin halına tam süstlük yol tapdı. Buna görə də o həzrət digər əmirlərdən və dövlət ərkanından etimadsız oldu və neçə gün [ərzində] səbr edərək döyüşü təxirə saldı. Elə ki xondgar Sultaniyyə-

[2080] Bakı nüsxəsinin bu yerində, pozulmuş bir cümlə daxilində "Məntəşa sultan və Oğlan xəlifə Qorçubaşını... göndərdilər" yazılmışdır (v.146a).
[2081] Məclis nüsxəsi: "Kərə çayı mənzilindən".
[2082] Nuruosmaniyyə və Ellis nüsxələri: "Yalquzağaca". Qaraağac – Əbhər yaxınlığındadır *(Seddon, şərhlər, s.264).*
[2083] Baroda nəşri: "fitnəsinin".

yə çatdı, payız fəslinin axırında qış qoşununun ön dəstəsi Sultan Süleymana meydanda düşmən kəsildi. Çoxlu qar yağdı.

Nəzm

"Göy üzündən yerə şəffaf qar yağdı,
Sanki nəddaf[2084] cəhrəsindən pambıq tökülürdü.
Qar lopalarının miqdarı hesabsız idi,
Dəvələr qarın üstündə zorla yeriyirdilər".

Dağların zirvələri və çəmənin səthi ağappaq oldu. Şaxta qoşununun basqınından yaşıllığın əmmaməsi və qəbası sənubərin başından və sərvin qəddindən töküldü. Buludların əlindən kafur kimi ağ damlalar aləmin ətrafına səpələndi. Rum hərbçilərinin əl-ayağı zay oldu və onların heyvanlarının çoxu yoxluq otlağına yollandı. Rum ordusunun adamlarından bir çoxları tələf oldular və "Göylərdəki və yerdəki ordular Allahın ixtiyarındadır"[2085] ayəsinin məzmunu zühura gəldi. Şairlərdən biri həmin hadisə haqqında [belə] deyib:

Nəzm

"Sultaniyyəyə gedib o qəribə çəmənə baxdıqda,
İki min gorsuz-kəfənsiz ölü gördüm.
Dedim: Bu qədər Osmanlını kim öldürüb?
Səhər küləyi aralıqdan[2086] qalxıb dedi: Mən"[2087].

Xondgar malik olduğu niyyətdən zərurət üzündən vaz keçərək kədər və təşvişlə Bağdadın yolunu tutdu. Dinin pənahı olan şah Qaraağacdan köç edib Dang ribatında cah-calalla dayandı və oradan Dərgəzinə keçdi. O mövqedə Əlvənd xan Əfşar min süvari ilə qələbə şüarlı əsgərlərə qoşuldu. Dinin pənahı olan şah, Mahmud ağa Ovçubaşını "dil" tutmağa göndərdi. Qazilər Xərrəqanın Kələkən[2088] mövqeyində düşmənlərə çatıb, onlardan beş nəfəri tutaraq aləmin pənahı olan dərgaha gətirdilər. Həmin əsirlər cahan hökmdarının ərzinə çatdırdılar ki, Sultan Süleyman çoxsaylı ordu ilə Bağdada yollanmış, Üləmə ilə Zülqədəroğlunu[2089] isə Təbrizə göndərmişdir. Bu sözü eşitdikdə zəminin və zamanın padşahı onların üzərinə sürətlə yürüdü. Qazi xan Təkəlü bu səadətli xanədana xəyanət etməyin əbasını əyninə geyib, qələbə şüarlı ordudan fərar edərək Təbrizə tələsdi. O, Üləməni dinin pənahı olan şahın gəlişindən xəbərdar etdi. [Qazi xan] nifaq əhlinin sərdarı (Üləmə) ilə ittifaqda Van qalasına sığındı. Kama yetmiş padşah qazilərin bir dəstəsi ilə Van qalasına hərəkət etdi.

Qala ətrafında müzəffər qoşunların çadırları quruldu. Qızılbaş sərdarları gözlərini açdıqda elə bir hasar gördülər ki, fələklərin qalası kimi yer aləminin sakinlərindən qorunur və elə bir bürc müşahidə etdilər ki, tayı-bərabəri ağıl dairəsindən kənardır. [Bu qalanın] hasarı [hündürlükdə] fələyin bürclərinə tən gəlirdi və dərin xəndəyi yer üzünü saxlayan öküzə qədər gedib çatırdı.

Şeir

"Hər kim göz gəzdirsə uca göylərə,
Bu qala uzaqdan gələr nəzərə.
Fələyə tay qorxunc qalada müdam,
Vardır dərin xəndək, yüksək istehkam.
Zühəl olar qapısında pasiban,
Edər tuba və sidrəni nərdivan.
Bir daş düşsə ulu qaladan hərgah,
O daşdan yaranar Elburztək dağ".

---

[2084] Nəddaf – pambıq emal edən usta, həllac. Burada məcazi mənada işlədilmiş, qar isə pambığa bənzədilmişdir.
[2085] *Qurani-Kərim, "Fəth" surəsi, 4 və 7-ci ayələr.*
[2086] Buradakı "miyanə" sözünü hərfi mənada "aralıq", "ortalıq" kimi də tərcümə etmək olar, Miyanə şəhərinin adı kimi də başa düşmək olar. Yəqin ki, burada bir söz oyunu vardır. Miyanə Sultaniyyəyə nisbətən şimaldadır və bəlkə də, şair səhər küləyinin Sultaniyyəyə Miyanədən əsdiyinə işarə etmişdir.
[2087] Məclis nüsxəsində bu rübainin müəllifinin Şeyx İnayət olduğu yazılmışdır.
[2088] Və ya "Çəkərkən". Bakı nüsxəsi: "Kələngin".
[2089] Baroda nəşrində və Məclis nüsxəsində yanlışlıqla "Üləmə Zülqədəroğlu" yazılmışdır.

Qalanın ətrafını əmirlər arasında bölüşdürdülər. Ölkə tutan alay basçıları və döyüşkən qorçular savaşa başladılar. Şeypur və zurna səsləri dairəvi bürclərin mühafizəçilərini təngə gətirdilər və sərsəm etdilər. Üləmə də bürc və hasarların başlarında şeypur və nağara çalınmasına göstəriş verdi. Rum qoşunları ox və tüfəng atmaqla məşğul oldular. Qızılbaş igidləri də top və tüfəngdən atəş açmağa başladılar. Tüfəng qaçılmaz qəzadan və ani ölümdən xəbər verirdi. Düşmən qıran zərbzən bədənlərdə dəliklər açırdı. Bir gün rumilər tərəfdən Dəli Mustafa[2090] qaladan çıxıb qızılbaş qoşununun qarşısında dayandı.

Nəzm

“Ordugahda durduğu vaxt hökmdar,
Qarşıdan gəldi at çapan şahsüvar.
Başında poladdan vardı bir külah,
Cövhərinə gövhər salırdı tamah.
Hind qılıncı asılmış kəmərindən,
Parlaq idi günəşin xəncərindən.
Qılıncın nuru kor edirdi gözü,
Özgə qılınc, yanında heçdir, düzü”.

Bu tərəfdən Dəli Tuğaçı qoşundan [irəli] çıxıb onunla vuruşdu.

Nəzm

“Məst bir ifrit kimi eylədi cövlan,
Bazusunda kəmənd, əlində kaman.
Çapdı irəli yel kimi sürətlə,
Meydanda durdu dağtək əzəmətlə.
Rəqib tələb etdi, döşünə döydü,
Özünün adını, sanını öydü.
Uzun nizəsi coşub qaynayırdı,
O mərəkədə nizə oynayırdı”.

Dəli Mustafa ona həmlə edib qalxanının ətəyinə bir nizə zərbəsi vurdu. Nizə onun böyründən keçdi və bu zərbə nəticəsində nizənin ucu qırıldı. Belə olduqda [Dəli Mustafa] qılıncını çəkib yenidən Dəli Tuğaçı[nın üzərinə] at çapdı və ona qılınc vurub dörd barmağını kəsdi. Bu tərəfdən Dəli Tərxan [oraya] at çapdı. Dəli Mustafa başqa adamın [Dəli Tuğaçıya] yardıma gəldiyini görüb qalanın içinə qaçdı.

Xülasə, hökmdar qışı o qalanın ətəyində başa vurdu. Xondgar isə Bağdada getdi. O diyarın valisi Məhəmməd xan Şərəfəddinoğlu dinin pənahı olan şahın əmrinə uyğun olaraq, Bağdadı tərk edib oradan çıxdı.

Bu əhvalatın təfərrüatı belədir ki, İbrahim paşa Mosuldan Məhəmməd xanın yanına təcrübəli elçilər göndərdi və sülhdən söz [salıb] dedi ki, qalanı təslim edin! Xan qəbul etmədi. O, təkəlü rəislərini çağırdı və məşvərət etdi. Onlar dinin pənahı olan şahın yanına getməyi qəbul etmədilər və mədrəsəni zəbt edib müxaliflik bayrağını qaldırdılar. Məhəmməd xan istədi ki, qiyamçıların üstünə getsin və onları cəzalandırsın. Seyid bəy Kəmunə mane oldu. Amma Məhəmməd xanın ürəyinə tam vahimə düşmüşdü. O, Qaravul adlı tir-kaman qorçusunu və Budaq bəy Köpəkalanı Bağdadın açarları ilə birlikdə Sultan Süleymanın yanına göndərdi. Buna baxmayaraq, eyni zamanda bərə körpünün ipini kəsib aləmin pənahı olan dərgaha yollandı və xeyli məşəqqətlə Bəsrəyə çatdı. O diyarın valisi Məqasim[2091], xanın əziyyətini çox çəkib onu salamatlıqla İraqa yola saldı. Məməmməd xan Dizfula gəldi. Sultan Süleyman Mosulda qışlaq etmək istəyirdi. Lakin Bağdadın açarını[2092] aparmış olan Məhəmməd xanın mülazimləri onu Bağdada gətirdilər və xondgar orada qışlaq etdi.

## Müxtəlif əhvalatlar

Bu il Sufiyan xəlifə Rumlu Xəbuşanda basqına gəlmiş Dərvişəli Moğolla döyüşüb onun yüz əlli adamını qətlə yetirdi.

---

[2090] Baroda nəşri: “Div Mustafa”.
[2091] Baroda nəşri: “Məqas”.
[2092] Nuruosmaniyyə nüsxəsi: “qalanın açarını”.

Bu il içində Sufiyan xəlifə Kəlat qalasında olan Seydim mirzə Özbəyin üzərinə gecə həmləsi edib özbəklərin bir çoxlarını qətlə yetirdi. Geri qayıdarkən onun mülazimlərindən iki yüz nəfər dağdan yıxılıb həlak oldu.

Xəlifənin zəiflədiyi barədə məlumat alan Dərvişəli Moğol min səkkiz yüz süvari ilə basqına gəldi. Sufiyan xəlifə beş yüz süvari və iki yüz piyada ilə onlarla savaşıb qalib gəldi və onun dörd yüz adamını qətlə yetirdi.

**Ölümlər**

Həzrət Şeyx Əli ibn Əbdüləali Müctəhid şənbə günü, 17 zilhiccədə (29.06.1534) fani aləmdən əbədi cahana tələsdi. [Onun ölüm] tarixinə "müqtədayi-şiə" ("şiə başçısı") [ifadəsi əbcəd hesabı ilə] uyğun gəldi[2093]. Onun "Haşiyeyi-əlfiyyə" ("Əlfiyyə haşiyəsi"), "Risaleyi-Cəfəriyyə" ("Cəfəriyyə risaləsi"), "Şərhi-irşad" ("İrşad şərhi")[2094] və "Şərhi-ləm'ə" ("Parlaq şərh") [adlı] əsərləri var.

Durmuş xanın kiçik qardaşı Hüseyn xan ibn Əbdi bəy Şamlu, Çuxa sultanın qətlindən sonra dinin pənahı olan şahın vəkili olmuşdu. Bu il dinin pənahı olan şahın könlü ondan incidi. Üstəlik, bu əyyamda onun tərəfindən törədilmiş bəzi qəbahətli əməllər də bu incikliyin üzərinə əlavə olundu. Qəbahətləri cümləsindən biri budur ki, şamlu qövmündən Hüseyn xanla qohumluğa malik və dinin pənahı olan şahın yanında hörmətə sahib Başdan Qara adlı birisi o həzrətə (Şah Təhmasibə) bəslədiyi ədavət səbəbindən şahın məxsusi şərbət şüşəsinin içinə zəhər atıb, o zəhərli şərbəti o həzrətə vermək istədi. Padşah fərasətlə və ya qeybdən gələn ilhamla o bədbəxtin qəsdindən xəbər tutdu. O səadətdən uzaq kimsə (Başdan Qara) onun (şahın) agah olduğunu görüb, dərhal bir bəhanə ilə məclisdən çıxaraq Mavəraünnəhrə tələsdi. Bəzi adamlar söz saldılar ki, Başdan Qaraya bu yaramaz sui-qəsdi törətməyi Hüseyn xan buyurmuşdur və bu söz zəmanə padşahının ürəyində yer tutdu. Hüseyn xan belə bir qəbahətə əl ataraq şeytani vəsvəsələrin zərurəti və nəfsani qayğıların arzusu ilə dövlət çevrilişi yolunda lazımınca səy göstərmək və insanları Sam mirzənin səltənətinə rəğbətləndirmək istəyirdi. Amma bilmirdi ki, mehtabın nuru boşboğazların fəryadından zavala uğramaz və günəşin çırağı ovsunçuların üfürməsi ilə sönməz.

Nəzm

"Günəşin parlaq şamı var,  
Onu nadan bilən deyil.  
Uca göydə məqamı var,  
Üfürməklə sönən deyil".

Bu əsnada şah onu (Hüseyn xanı) qaravulluğa göndərdi. Onun mülazimlərindən Həsən ağa dinin pənahı olan şahın ərzinə çatdırdı ki, tezliklə Hüseyn xan inad yolunun yolçusu olacaq və rumilərin ordusuna yollanacaq. Dinin pənahı olan şah onu [hüzuruna] tələb etdi və işarə etdi ki, onu parça-parça etsinlər, Qənbəroğlu isə onun başını nizənin ucuna keçirib şah ordusunda gəzdirsin. Onun qoşununu Bəhram mirzəyə verdilər.

Əmir Nemətulla Hilli Hillənin ulu seyidlər zümrəsindən idi. O həzrətin fəzilətləri, kamillikləri və ictihad[2095] üçün lazım olan elmlərdəki məharəti o həddə çatmışdı ki, bir sıra insanlar onun ictihad dərəcəsinə yetişdiyini güman edirdilər və onun özü də ictihad iddiası ilə [çıxış] edirdi. Amma üləmalar bunu qəbul etmirdi. Onun ali fəhminin itiliyi və zəkasının qavrama qabiliyyəti o dərəcədə idi ki, bir sıra üləmalar maddi və dini cəhətdən ondan daha üstün rütbəyə malik olsalar da, mübahisədə ona müqavimət göstərməyə tab gətirmirdilər və o, sözünü onlara qəbul etdirirdi. Bəzən isə mahiyyətindən xəbərdar olmadığı bir elm haqqında bəhs edirdi və fəhminin itiliyi, nitqinin səlisliyi sayəsində önə çıxırdı. Belə ki, heç kəs məsələnin gerçək üzünü görə bilmirdi və insanlar zənn edirdilər ki, o, həmin elmdə məharət sahibidir. O, "Həzrəti-Xatəmül-müctəhidin" (müctəhidlərin möhürü) və "Varisi-ülumi-seyyidül-mürsəlin" (peyəmbərlər ağasının elmlərinin vari-

[2093] "Müqtədayi-şiə" = 940 h.

[2094] Məclis nüsxəsi: "Şərhi-qəvaid" ("Qaydaların şərhi"), "Haşiyeyi-irşad" ("İrşad haşiyəsi"), "Haşiyeyi-şəraye" ("Şəriət haşiyəsi"). "Haşiyeyi-şəraye" əsərinin adı Bakı nüsxəsində də çəkilmişdir.

[2095] İctihad (ərəbcə hərfən "çox çalışmaq" mənasını verir) – din alimlərinin çatdıqları ən yüksək səviyyə olan müctəhidlik məqamını bildirir; həmçinin müctəhidlərin "Quran" və hədislərin tədqiqi əsasında verdikləri şəriət hökmlərinə də "ictihad" deyilir.

si) ləqəblərinə malik olan Əli ibn Əbdüləalinin tələbələrindən idi və onun bütün tərəqqisi o həzrətin [elmindən] istifadə etməsi səbəbindən üz vermişdi. Amma axırda nankorluq edərək o həzrətin haqqını tapdalamışdı. Belə ki, Xatəmül-müctəhidinlə Şeyx İbrahim Qətifi arasında münaqişə vardı və sözügedən Əmir Nemətulla öz müəllliminə məhəl qoymayaraq bəzi fiqhi məsələlərdə onun rəqibinin tərəfini saxlayırdı. Bəzən isə xilafət təyinatlı taxtın ətəyində olduğu vaxt İbrahim Qətifiyə məktub yazırdı və onu Həzrəti-Xatəmül-müctəhidinin ziyanına səbəb ola biləcək işlərə həvəsləndirirdi. Amma haqqında bu cür söz-söhbətlərin yayılmasına baxmayaraq, [Xatəmül-müctəhidinin] şanına nöqsan yol tapmadı. [Əmir Nemətulla isə] çeşidli dini və dünyəvi azarlara və zərərlərə düçar oldu. İmamın və ya imam naibinin olmadığı yerdə cümə namazının səhihlik şərtləri haqqında fiqhi hökmün nədən ibarət olması məsələsində də o, Həzrəti-Xatəmül-müctəhidinin rəyinə xilaf çıxdı və behişt ayinli məclisdə onunla bu barədə mübahisə etdi. O, üləmalardan və fəqihlərdən Qazı Müsafir, Mövlana Hüseyn Ərdəbili kimi bəzilərini və Həzrəti-Xatəmül-müctəhidinə qarşı ədavət və küdurət məqamında dayanan bir dəstə adamı həmin bəhsdə özünə müttəfiq etmişdi və şahın əmirlərindən və dövlət ərkanından da Mahmud bəy Möhürdar, Məlik bəy Xoyi və başqaları onlara himayəçilik edirdilər. Amma həmin məclis mütləq bir qərarın qəbulu ilə sona çatmadı, o bəhsdə irəli sürülən fikirlər fəaliyyətə keçmədi və məsələ [onların] mətləbinə uyğun şəkildə nəticələnmədi. O zaman Həzrəti-Xatəmül-müctəhidinə münasibətdə çeşidli yalanlardan və böhtanlardan ibarət şər bir məktub yazıb o həzrətin darüssəltənə Təbrizin Sahibabadında, Nəsriyyə zaviyəsi yanında yerləşən evinə gizlicə atdılar. Bu məktub məchul bir xətlə yazılmışdı və orada o həzrət müxtəlif günahlarda və əxlaqsızlıqlarda ittiham edilmişdi. Qüdrətli padşah – onun hökmranlığı və səltənəti uzun olsun – məktubun katibinin və baiskarlarının aşkarlanmasına xeyli cəhd göstərdi. Axırda bəlli oldu ki, Həzrət Mirin (Əmir Nemətullanın) bundan xəbəri varmış. Günlər ötdükcə Xatəmül-müctəhidinin ona qarşı küdurəti elə bir həddə çatdı ki, bu iş onun sürgün edilməsi və [saraydan] uzaqlaşdırılması ilə nəticələndi. Ona ali divandan bir bukavulu müvəkkil [təyin] etdilər ki, onu Təbrizdən çıxarıb Bağdada aparsın. O zaman Bağdad hakimi olan Məhəmməd xan Təkəlünün adına ali divandan bir hökm verildi ki, Mir Nemətullanın Şeyx İbrahim Qətifi ilə və Xatəmül-müctəhidinin digər düşmənləri ilə əlaqə və münasibət saxlamasına imkan verməsin və onun əhvalına dair gerçəkliklərə vaqif olsun (onun hərəkətlərinə nəzarət etsin). O, Bağdada getdikdən bir az sonra Həzrəti-Xatəmül-müctəhidin də mürəxxəs olub İraqi-Ərəbə yollandı və o həzrətin vəfatı ilə Mir Nemətulla Hillinin vəfatı arasında on[2096] gündən artıq fasilə olmadı.

Həzrət şeyxin (Xətamül-müctəhidin Əli ibn Əbdüləalinin) kəramətləri cümləsindən sayıla biləcək işlərdən biri odur ki, o həzrətin ən qatı rəqiblərindən və düşmənlərindən olan Mahmud bəy Möhürdar bir gün Sahibabad meydanında qüdrətli sahibqiranın xidmətində çövkən oynayırdı və xeyli lovğalıq və qürurla o geniş sahədə hər tərəfə [at] çapırdı. O gün cümə günü idi, ikindi vaxtına yaxın idi. Həzrəti-Xatəmül-müctəhidin onun şərinin, fitnəsinin və fəsadının dəf olunması üçün "duayi-seyfi" (qılınc duası) və himmətli imam Əba-Abdulla əl-Hüseynə – ona dua və salam olsun – məxsus olan məzlumun zalımdan qurtulması duasını oxudu. Hənüz ikinci duanı tamama yetirməmişdi və "onun əcəli yaxındır və oğlu yetim qalacaqdır" kəlmələri dilində idi ki, Mahmud bəy çövkən oynayan əsnada atdan yıxıldı, başı ayaq altda qalan top kimi at tapdaqları altındaköməksiz qaldı, torpağın üstündə zillətə düşdü və rəzilliklə yeksan oldu.

Mövlana Lisani nəzmlə məşğul olan böyük söz ustadları silkində qərar tutmuşdu. Onun şeirlər divanı məşhurdur və bəlağət əlamətli beytləri fazillərin xatirinin lövhəsində həkk olunmuşdur. O, bu il dünyadan köçdü və Sürxabda dəfn edildi[2097].

## 941-Cİ İLDƏ (13.07.1534 – 01.07.1535) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Rum padşahı Sultan Süleymanın ikinci dəfə Azərbaycana gəlməsi

Sultan Süleyman Bağdadın zəbtindən arxayın olduqdan sonra Azərbaycana hərəkət etdi. Dinin pənahı olan şahın cahanı bəzəyən düşüncə aynası ilahinin sığalı ilə cilalanmışdı və o, dövlət sahiblərinə lazım

[2096] Məclis nüsxəsi: "iki".

[2097] Səfəvilərin ilk dövrünün şairlərindən olan Mövlana Lisani müşk satıcısı olan Məhəmməd Şirazinin oğludur. O, Şirazda doğulsa da, ömrünün çox hissəsini Bağdadda və Təbrizdə yaşamış, farsca şeirlər yazmışdır *(Şeyx Müfid Davər. Təzkireyi-miratül-füsəha, ba təshihü təkmilü əfzudehayi: M.Tavusi. Şiraz, 1371, s.539-541)*

olan səbir etmək qaydasına riayət edib, Van qalası ətəyindən qalxaraq Təbrizə yollandı. Orada nifaq əhlinin qalıqlarından olan Məlik bəy Xoyi cəzalandırıldı. O əsnada Dəli Xürrəm[2098] xondgarın yanından fərar edib gəldi və Rum qoşununun yaxınlaşdığı xəbərini yetirdi. Dinin pənahı olan şah Sultaniyyəyə yollanıb Dərcəzinə gəldi. Oradan Əmir sultan Rumlu ilə Çıraq sultan Ustaclunu qaravul kimi xondgarın qoşunları tərəfə yolladı. Onlar Dərcəzinin Dəmə kəndində xondgar ordusuna çatdılar. Rumilər xeyli qürurlu bir şəkildə onlara həmlə etdilər. Çıraq sultanın mülazimlərinin əksəri fərar edərək arxalarına belə baxmadılar. Əmir sultanın təxminən iki yüz nəfərlik mülazimləri isə mərdanə döyüş apardılar. Əmirlər rumilərin üzərinə at çaparaq çoxlarını qırıb yerə tökdülər və onların başlarını bədənlərindən ayırıb dinin pənahı olan şahın yanına gətirdilər. Lakin dostlarının namərdlikləri səbəbindən, qaçan rumiləri təqib etmədilər.

Elə ki qızılbaş ordusunun kiçik bir dəstəsinin bu tərzdə döyüşməsi Sultan Süleymana agah oldu, bu, onun xatirinə ağır gəldi, həyəcanlandı və [bu hadisəni] öz əmirlərinin başına qaxınc edərək [dedi]:

- Bir halda ki iki yüz nəfər qızılbaşı giriftar edə bilmədiniz, bəs, o həzrətin (Şah Təhmasibin) cavabını necə verəcəksiniz?

O, Dərcəzindən geri dönüb, hərəkət, bəlkə də, məğlubiyyət bayrağını Rum tərəfə qaldırdı. Dinin pənahı olan şah rumilərin Dərcəzində hərəkət yüyənlərini geri dartıb [öz məmləkətlərinə tərəf] qayıtdıqlarını eşitdikdə, yürüş bayrağını onların ardınca yüksəldib tam sürətlə hərəkətə gəldi. O, Bəhram mirzəni, Məntəşa sultanı, Əmir sultanı, Şahqulu xəlifə Möhürdarı, Məhəmməd Əmin bəy Süfrəçini, yasavullardan və qapıçılardan ibarət bir camaatı basqın etmək üçün İbrahim paşanın arxasınca göndərdi. [Şah Təhmasib] öz nəfis vücudu ilə köhlən [atına minib] yüyənini Van qalası səmtinə çevirdi. O zaman Sultan Süleyman tərəfindən rumilərin bir dəstəsi [həmin] qalada qoyulmuşdu. Onlar müzəffər qoşunun hərəkətindən xəbərdar olduqda, qalanı yiyəsiz buraxıb fərar etdilər. Həmin ilin 20 rəbiüləvvəlində (29.09.1534) cahan padşahı cah-calalla Van çəməninə təşrif gətirdi və qalanı ələ keçirdi. Dinin pənahı olan şahın qalaya yiyələnməsindən öncə xondgar qazilərin qalanı tuta biləcəyi qorxusuna qapılaraq batil bir niyyətlə Diyarbəkr əmirülümərası Məhəmməd paşanı Üləmə Təkəlü, Dəli Pərvanə, Əhməd bəy, Mustafa bəy, Bədir bəy, İdris paşa, Meyzədə (?)[2099] hakimi Məlik Süleyman və Məlik Veys sultanla bərabər iki min yeniçəri və on min süvari ilə Van qalası qarnizonunun yardımına göndərmişdi və o bədbəxtlər Vostan hüduduna gəlmişdilər. Eyni zamanda, türkman qorçularından bəziləri çaharşənbə günü, 24 rəbiüləvvəldə (03.10.1534), əsr vaxtı xəbər almaq məqsədi ilə Vostan tərəfə getmişdilər. Onlar qürub çağında [rumilərə] çatdılar, neçə nəfəri qətlə yetirdilər və üç şəxsi tutub hökmdarın dərgahına göndərdilər. Beləliklə, rumilərin gəlişi məlum oldu. Elə həmin an dinin pənahı olan şah dağ görkəmli, bulud şəkilli atına süvar oldu. Bu at elə bir at idi ki, su kimi yuxarıdan aşağıya enirdi və atəş kimi aşağıdan yuxarıya çıxırdı.

Nəzm

“Qara gözlüdür, saçları müşk ətirlidir,
Pəri üzlü, ahu sürətli, cüyür dırnaqlıdır.
Ürək əndişəsindən daha yeyin qaçır,
Müdriklərin düşüncəsindən daha yaxşı yol tapır.
Gecə olsa da, o, yenə çapmağa davam edər,
Gündüzlərini də eləcə qaçışla keçirər.
İnsanın yorulmadan ətrafa göz gəzdirdiyi tərzdə,
O da bu göz gəzən yerlərə yetişər və yorulmaz.
Qaranlıq gecədə iki yüz mil uzununda yol,
Onun üçün qara palazdakı qarışqa yolu kimidir”.

[Şah Təhmasib] dərgah məxsuslarından və döyüşkən qorçulardan ibarət bir dəstə ilə hərəkət yüyənini onlara tərəf çevirdi. Cahan padşahının məiyyəti Vostan hüduduna çatdıqda aydın oldu ki, o bədbəxtlər qaravullarla qarşılaşmadan sonra işin çarəsini fərar etməkdə görüb tam sürətlə Gevaşa[2100] getmişlər.

Nəzm

[2098] Bakı nüsxəsi: “Dəli Xürrəm Kasər” (?)
[2099] Baroda nəşri: “Həniv”; Bodleian nüsxəsi: “Hiz”; London nüsxəsi: “Təbər”; Məclis və Bakı nüsxələri: “Yəzd”.
[2100] Gevaş – Van gölünün cənub-şərqində, Türkiyənin Van vilayətində qəsəbə və ilçə mərkəzidir.

“Bir adamdan ki tale üz döndərsə,
O, çalışmaqla bəladan xilas olmaz.
Əgər külək olub qaçmağa başlasa,
Asiman yuxarıdan başına fitnə tökəcək”.

Şahın qələbə ayətli bayraqları Allahın himayəsi sayəsində o çətin yoldan keçib bir dağ başında həmin şövkətli güruha çatdılar. O zaman ali mənşəli şahın yanında iki min süvari vardı. Çünki ordunun digər hissəsi yolda yatıb qalmışdı. Üləmə hərçənd Məhəmməd paşaya ərz edib dedi:

- Dinin pənahı olan padşahla qarşı-qarşıya gəlməyi məsləhət görmürəm. Çünki ordumuz o həzrətin həmləsinə və şiddətinə taqət gətirmək gücündə deyildir.

Şeir

“İti dilli xəncər söz deməyə başlasa,
Kəlmələrinin hamısı bədən səhifəsinə yazılar”.

[Amma Məhəmməd paşa] qəbul etməyib, zəfər nişanlı əsgərlərin qorxusundan yeniçəriləri səfin önündə saxladı və səf bağlayaraq döyüş və vuruş niyyətinə düşdü. O əsnada Yaraq[2101] bəy Vəkil Zülqədər Tanrının yardımının yol göstərməyi ilə o çoxsaylı qövmün arasından fərar edib [şahın] büsatını öpmək izzətinə müşərrəf oldu və nicat şərəfi tapdı.

Onların qaraltısı şah qoşununa məlum olduqda əyalət hakimlərindən Qazi xan Zülqədər türkman və zülqədər qorçularından ibarət bir dəstə ilə [şahın] qələbə əlamətli məiyyətindən öncə o qövmü dəf etməyə yeridi. Döyüş mərəkəsinin şirləri və savaş meydanının səf yaranları qaniçən aslanlar kimi idbar əhlinə həmlə etdilər, ürək deşən oxlardan, ildırım kimi çaxan tüfənglərdən qətiyyən qorxmadılar və elə ilk həmlədə Allahın yardımı ilə onların varlıq xırmanına yoxluq atəşi saldılar. Bir göz qırpımında o mənfur qövmdən dörd yüz nəfəri iti qılınca yem etdilər və onların başlarını bədənlərindən ayırıb şahın gözəl yerişli atının ayaqları altına atdılar. Bir sıra digərlərini, məsələn, Dəli Pərvanəni, xondgarın qorçubaşısı Mühyi[2102] Çələbini əsir tutub əşrəfin nəzərləri qarşısına gətirdilər. Qalib əsgərlər o məğrur güruhun qılıncdan qurtulanlarını Bitlis hüduduna kimi təqib etdilər. Onların bütün yükləri və malları qazilərin əlinə düşdü.

Eyni zamanda, Bəhram mirzə və b. əmirlər Ərcişə yollanmışdılar. Sözügedən qalanın ətrafında [oradakı] qalaların mühafizləri qələbə şüarlı qoşunlarla qarşı-qarşıya gəldilər. Müzəffər qazilər onlardan təxminən iyirmi nəfəri qətlə yetirdilər. Qılıncdan qurtulanlar yüz hiylə ilə özlərini qalaya saldılar, xondgarın yanına adam göndərib yardım istədilər. Xondgar, Sinan paşanı, Dərzi Əlini, Hacı paşanı və sancaq əmiri Yəhya bəyi çoxsaylı bir dəstə ilə onların yardımına göndərdi. Budaq xan Qacar[2103] xeyli dilavərlərdən ibarət bir dəstə ilə həmin çoxsaylı ordunun qarşısına çıxıb qüdrətli dövlətin gücü ilə onlara qalib gəldi. Sinan paşanı yüz nəfərlə birlikdə qətlə yetirdilər, Hacı paşa ilə Yəhya paşanı isə ölümcül hala saldılar. Sinan paşanın başını digər öldürülənlərin [başları] ilə bərabər Van çəmənində hökmdar ordusuna gətirdilər.

Sinan paşanın qətl xəbəri xondgara çatdıqda, öz qoşununun bir hissəsini İbrahim paşaya yoldaş edib [Ərciş] qalasında yerləşənlərin köməyinə göndərdi. Adı çəkilən paşa özünün işə yarayan adamlarının bir dəstəsini mənqəlay təyin edib Bəhram mirzə ilə savaşmağa göndərdi. Qazilər və dilavərlər onları məğlub etdilər və çavuşlardan, mötəbərlərdən neçəsini əsir tutub Bəhram mirzənin yanına apardılar. Elə ki İbrahim paşa bu hadisənin baş verməsindən xəbər tutdu, qala adamlarını oradan çıxarıb tam sürətlə öz məqamına yollandı. Qüdrətli dövlətin[2104] gücü ilə Van və Ərciş ölkəsi fəth edildi. O diyarın əyalət hakimliyi və o qalanın kutvallığı Əhməd sultan Sufioğluya verildi.

### Sam mirzə ilə Ağzıvar xanın yağı olub Qəndəhar tərəfə getməsi və onların Mirzə Kamran tərəfindən məğlubiyyətə uğradılması haqqında söhbət

Dinin pənahı olan şahın Heratdan getməsindən sonra Sam mirzə və Ağzıvar xan hökumət kürsüsünə əyləşdilər. Ağzıvar bütün səylərini ordunun və rəiyyətin əhvalının yaxşılaşmasına sərf etdi, seyidlərə, məva-

[2101] Baroda nəşri və Bakı nüsxəsi: “Budaq”.
[2102] Məclis nüsxəsi: “Vəhmi”. Bakı nüsxəsi: “xondgarın qorçubaşısı və Mühyi Çələbi”.
[2103] Məclis nüsxəsi: “Budaq sultan”.
[2104] Baroda nəşri: “şahın dövlətinin”; Məclis nüsxəsi: “düşmənləri bədbəxt edən bəxtli dövlətin”.

lilərə, orta və aşağı təbəqədən olan adamlara hörmət və ehtiram etməyə tam diqqət yetirib mərhəmət bayrağını qaldırdı.

Herat şəhərində altı aydan artıq müddətdə hökm sürdükdən sonra Hüseyn xanın qətli və şamluların əhvalının pərişanlığı haqqında xəbər Herata çatdı. Ağzıvar xan vahiməyə düşdü ki, Hüseyn xanın başına gələn [iş] onun [da] başına gələcəkdir. O əsnada üzüqara[2105] Başdan Qara Mavəraünnəhrdən qaçıb, Ağzıvarın və Sam mirzənin yanına gələrək onları [şaha qarşı] müxalif olmağa təhrik etdi. Onlar həmin nadan cahilin sözünə aldanıb başlarını itaət boyunduruğundan və ayaqlarını tabeçilik caddəsindən kənara çıxardılar, cəhalət və zəlalət atına süvar olub, nankorluq yolunun yolçusuna çevrilərək əmin-amanlıq mərhələlərini geridə qoydular. O əsnada [Sam] mirzənin və [Ağzıvar] xanın mülazimləri Herat sakinlərinin evlərinə daxil olaraq mal-dövlət sahibi olduğunu güman etdikləri kimsələrin zahiri sərvətlərini xanın rüxsəti ilə ələ keçirmiş, gizlədilmiş mal-dövləti tələb etmək üçün ev sahiblərinə işgəncə vermişdilər.

Ağzıvar xanın məsləhəti ilə ali mənşəli şahzadə əldən düşmüş şamlulardan və yaşlı sipahilərdən Xəlifə sultan Miraxuru, Mahmud bəyi[2106] və Ümmət bəyi Heratda qoyub, qeyd olunan ilin 15 şabanında (19.02.1535) Qəndəhar səmtinə hərəkət bayrağını qaldırdı. Fərah əyalətində Murad sultan Əfşar məcburiyyət üzündən Ağzıvara qoşuldu və [axırda] öldürüldü.

Sam mirzə və Ağzıvar xan xeyli qoşunla Qəndəhara çatdılar. O vaxt Mirzə Kamran tərəfindən Xoca Kəlan o diyarın hakimi idi. O, hadisədən agah olduqda, ətraf nahiyələrin əhalisini qalaya daxil edib, bürcü və hasarı möhkəmləndirərək müdafiə olunmaq qərarına gəldi. Sam mirzə və Ağzıvar qalanı bir dairə kimi əhatəyə aldılar. Xoca Kəlan bir dəstə dilavərlə intiqam qılıncını igidlik qınından sıyırıb, müxaliflik qalxanını üzünə tutaraq qaladan çıxdı. Qılınca və mizrağa əl atdılar. Ağzıvar da özünü onlara vurub, bir çoxlarına qılınc sərpəncəsindən fəna şərbəti içirərək düşmənləri qalayadək qovdu. Neçə ay ərzində yolunu azmış Ağzıvar məiyyəti və ordusu ilə qala hasarının yanına gedib döyüş alətlərindən istifadəyə əl atdı. Mühasirə işi uzun müddət uzandı. Sam mirzə dövlətə qarşı qüsur işlədiyi üçün onun səy kəməndi məqsəd bürcünün zirvəsinə çatmadı və Ağzıvar xanın qan yağdıran qılıncının güzgüsü kama yetmiş şaha qarşı ədavət tozuna bulaşdığına görə fəth və zəfər surətinin məzhərinə çevrilmədi. Xoca Kəlan o zaman Lahorda olan Mirzə Kamranın yanına təcrübəli qasidlər göndərdi və yardım istədi. Mirzə Kamran dərgah yaxınlarının və saray adamlarının məsləhəti ilə o zaman Aqrada olan Hümayun padşahın yanına adam göndərdi və qoşun istədi. Padşahın fərmanı ilə Hindistan məmləkətlərindən fələk qüdrətli ordu Mirzə Kamranın hüzuruna cəmləşdi. Ondan sonra [Mirzə Kamran] Qəndəhar istiqamətində hərəkətə keçdi və Qaraca bəyi mənqəlay təyin edib köçhaköçlə Kabilə gəldi. Tərtib edilmiş ordu ilə oradan Sam mirzənin və Ağzıvarın [üzərinə] yeridi. Qızılbaş qoşunu bir mənzil geri çəkildi. Mirzə Kamran və sərdarlar məşvərət üçün toplandılar. Xoca Kəlan döyüşməyi məsləhət gördü və digər sərdarlar da onun sözünə şərik oldular. Buna görə də Mirzə Kamran Qəndəhar ətrafından köç edib, Qəndəhardan yeddi fərsəx aralıda yerləşən Sam mirzənin düşərgəsi üzərinə hərəkət etdi.

[Mirzə Kamran] onların yaxınlığına çatdıqda səflərin qurulması işi ilə məşğul oldu. Sam mirzə sağ cinahı Ağzıvara tapşırdı, sol cinahı Bilal sultan Əfşara[2107] həvalə etdi və özü şəxsən mərkəzdə qərar tutdu. Digər tərəfdən Mirzə Kamran iyirmi min cavanla Sam mirzənin iki min adamının qarşısında səf bağladı. Ağzıvar bir dəstə dilavərlə birlikdə sol cinahın sərdarı olan Xoca Kəlanın üzərinə qızğın şir kimi həmlə etdi.

Şeir

“Cövlana gəldi məst aslan kimi,
Yer öküzünün başı və buynuzu qırıldı.
Onun bir qoşunu vardı ki, hamısı cövşənə qərq olmuşdu,
Sanki qızmar atəş dəmir içində qərar tutmuşdu”.

[Ağzıvar xan] onların bir dəstəsini atdan saldı. Xoca Kəlanın mülazimləri məyusluq və pərişanlıq içində fərar yolunu tutdular. Ayağını möhkəm yerə basan Xoca Kəlan isə igid şamluların nizə zərbəsi ilə yə-

---

2105 “Üzüqara” (“yüziqara”) sözü orijinal mətndə də türkcə verilmişdir. Ə.Nəvai bu türkcə ifadəni yanlış olaraq adam adı kimi başa düşmüş, mətni şərh edərkən Yüziqaranın (Üzüqaranın) Başdan Qara adlı şəxsin atası olduğunu bildirmiş və “Üzü Qara oğlu Başdan Qara” kimi oxumağı təklif etmişdir *(Nəvai, şərhlər, s.1230).*

2106 Məclis nüsxəsi: “Məhəmməd bəyi”.

2107 Məclis nüsxəsi: “Lal sultan Əfşara”.

hər üzərindən yerə düşdü. Lakin cüssəsinin[2108] möhkəmliyi ucbatından ona ciddi bir bəla yetişmədi. Mirzə Kamranın mülazimləri onun köməyinə çatdılar.

Şeir

“O qiyamətdə müxalif qoşunundan,
Bir dəstə özünü yetirdi qəzəbli və sürətli sel kimi.
Hamısı dağ görkəmli və əzəmətli idilər,
Kin kəmərini bağlamışdılar, Elburz dağı kimi heybətli idilər”[2109].

Onlar onu coşqun dənizin təlatümündən xilas sahilinə çıxardılar. O əsnada Sam mirzənin qəzəb alovu alışdı, zəhər təbiətli qılıncını qeyrət qınından sıyırıb, sağ cinahın[2110] sərdarı olan Qaraca bəyin üzərinə həmlə etdi və onları geri oturtdu. O, Qaracanı qovaraq mərkəzə çatdıqda, Qaraca geri dönüb Sam mirzəyə həmlə etdi. O əsnada Ağzıvar ali mənşəli şahzadənin imdadına yetmək üçün Qaraca bəyin üzərinə at çapdı. [Lakin] döyüş meydanının ortasında onun atının əli bir deşiyə düşdü. O xudpəsənd bahadır atını nə qədər mahmızlasa da, at əlini o dəlikdən çıxarmağı bacarmadı. Bu vəziyyətdə cağataylardan məchul bir kimsə ona çatdı və onu atdan salıb Kamran mirzənin cəza əlamətli nəzəri qarşısına gətirdi. [Ağzıvar xan] onun fərmanı ilə öldürüldü.

Ağzıvarın öldürülməsindən sonra Sam mirzənin ruzigarında zəiflik və sınıqlıq nişanələri zahir oldu. O, Gərmsir tərəfə qaçdı. Mirzə Kamran belə bir qələbənin ardından Lahora qayıtdı. Sam mirzə anladı ki, bu məğlubiyyət dinin pənahı olan şaha müxaliflik etdiyi üçün baş vermişdir. Buna görə də onu xilaf işlərə bulaşmağa təhrik etmiş Başdan Qaranı və üzüqara bədbəxtlərdən bəzilərini öldürdü və başlarını ərizə ilə birlikdə ərşə bənzər dərgaha göndərdi. Ərizənin məzmunu belə idi: “Dövranın yaramaz münafiqlərindən bəziləri məni dinin pənahı olan şaha qarşı müxalif olmağa təhrik etdilər. Bu üzdən belə pis vəziyyətə düşdüm və çətinliyə giriftar oldum. Cəhalətimin və qürurumun bais olduğu bu xoşagəlməz müxalifliyimə görə peşman olub peşmançılıq barmağımı təəssüf ağzıma qoymuşam. Əgər dinin pənahı olan şahın mərhəməti bu müxlisin əhvalına şamil edilərsə və günahlarım əfv suyu ilə yuyularsa, ayağımın əvəzinə başımı yerə qoyaraq ali taxtın ətəyinə gələrəm”.

### Sufiyan xəlifə Rumlunun Übeyd xan Özbəyin əmirləri ilə müharibə etməsi haqqında söhbət

Bu il Şeyx Əbu-Səid Əfrasiyab, Qaraca Bahadır və Seydim mirzə dörd min süvari ilə Xorasan vilayətinə basqına gəldilər. Sufiyan xəlifə bu xəbəri eşidən kimi min beş yüz süvari ilə onlara qarşı yollandı. O, Zavə yaxınlığında düşmənlərə çatdı və onların qarşısını kəsib həmlə etdi. Özbəklər məğlubiyyət yolunu tutdular. Qazilər o pis taleli qövmdən iki yüz əlli nəfəri qətlə yetirdilər. Şeyx Əbu-Səid Əfrasiyab iztirabının çoxluğu üzündən bir çalada gizləndi. Cam kətxudası o natamama bir at verib onu Buxaraya yola saldı.

Bu il içində Sufiyan xəlifə Xafa yollandı və Übeyd xan tərəfindən basqına göndərilmiş min özbək süvarisinə çatıb, onları da məğlub edərək iki yüz nəfəri qətlə yetirdi.

### Bayram-oğlan Özbəyin Xorasan vilayətinə basqına gəlməsi, Xəlifə sultan Şamlu ilə müharibə etməsi və qazilərin məğlubiyyətə uğraması haqqında söhbət

Sam mirzə ilə Ağzıvar xanın Qəndəhar tərəfə getməsindən sonra ömrünün əyyamı səksən yaşı keçmiş Xəlifə sultan Şamlu [Heratda] hökumət kürsüsünə əyləşdi. Mahmud bəylə Ümmət bəy də münasib mənzillərdə qərar tutdular. Beləliklə, çərxi-fələyin gərdişi ucbatından, bu əldən düşmüş qocalar iş başına keçdilər və Xəlifə sultanın zəifliyi, digər iki sərdarın zəbunluğu [haqqında xəbərlər] ətrafa və yan-yörəyə yayıldı. Canibəy sultanın oğlu Kəskən Qara sultanın tərəfindən Qərcistan vilayətinin hakimi olan Bayram-oğlan Özbək qoşun toplayıb Heratrud vilayətinə basqın üçün hərəkətə gəldi. Elə ki adı çəkilən vilayətə çatdı, çoxlu mallar

---

[2108] Məclis nüsxəsi: “cəbbəsinin (zirehinin)”.

[2109] Bu son beytin ilk misrası heç bir nüsxədə mövcud deyil. Məclis nüsxəsində isə ümumiyyətlə ikinci beyt yoxdur. Sözügedən misra Bakı nüsxəsi (v.154a-b) əsasında tərcümə edilmişdir. Bakı nüsxəsində ilk beytin ikinci misrası belədir: “Bir dəstə özünü yetirdi iti qılınc kimi”.

[2110] Nüsxələrdə “sol cinahın sərdarı” yazılsa da, daha öncə həmin cinaha Xoca Kəlanın başçılıq etdiyi göstərilmişdir. Ona görə də burada “sağ cinahın sərdarı” ifadəsi daha münasibdir *(Nəvai, şərhlər, s.1232)*.

ələ keçirdi. Bu xəbər Xorasan hakimlərinə çatdıqda tədbirsiz kələntərlər, vəzirlər və əmirlər məşvərət büsatı üzərində əyləşdilər. Mahmud bəy məsləhət gördü ki, şəhərdən kənara çıxmasınlar. Amma mərhum cənab Əmir Sultan İbrahim Əmini və müdriklikdən bir nəsibi olmayan bir sıra şəxslər Mahmud bəyin doğru fikri ilə razılaşmadılar və dedilər:

- Qəlbimizə qorxu-hürkü salmamalıyıq, savaşa və döyüşə könül verməliyik.

[Xəlifə] sultan cənabları Əmir Sultan İbrahim Əmininin tövsiyyəsinə əməl edib hökm verdi ki, şəhərin və şəhərətrafı bölgələrin ("bölükat") kələntərləri atı və əsləhəsi olan hər kəslə şəhərdən çıxsınlar və müharibədə qazilərə yoldaş olsunlar.

Böyüklərdən Əmir Sultan İbrahim Əmini və əyanlardan Şahməhəmməd Camebafla[2111] Şadi Məhəmməd Əsəs[2112] döyüş əsləhəsini qurşanıb Xəlifə sultanın bayrağı altında özbəklərlə savaşmaq üçün qeyd olunan ilin zilqədə ayının 19-da (22.05.1535) şəhərdən çıxdılar və Mahmud bəyi məhdud bir dəstə ilə mühafizə üçün şəhərdə qoydular. Herat şəhərindən on fərsəx məsafədə yerləşən Heratrud vilayətinin İsfizar kəndinə çatdıqda düşmən ordusunun qaraltısını müşahidə etdilər. Xəlifə sultanı [şəhərdən] çıxmağa və hərb etməyə rəğbətləndirmiş şəxslər öz dediklərindən peşman və pərişan oldular və onların ürəklərinə müqayisəyəgəlməz xof və qorxu yol tapdı. Qəzavü-qədər Bayram-oğlanı döyüş meydanına tərəf hərəkətə gətirdi və o, öz hərəkət yüyənini başsız qazilər səmtinə çevirdi. Döyüş meydanı qızışdı. Amma Xəlifə sultanın əsgərləri hərcayi, müftəxor və öz sərdarlarına sədaqətsiz adamlar olduqlarından, müharibədən qaçıb dağılışdılar. Bayram-oğlan onlara qalib gəldi. Xəlifə sultan və Əmir Sultan İbrahim Əmini mülazimlərdən və şəhərlilərdən doqquz yüz nəfərlə birlikdə qətlə yetirildilər. Bayram-oğlan öldürülənlərin başlarını bədənlərindən ayırıb oradan Qərcistana yollandı.

### Müxtəlif əhvalatlar

Bu il dinin pənahı olan şah Təbrizdə qışlaq etdi.

Bu il içində dinin pənahı olan şah, Əlvənd xan Əfşarı[2113] qətlə yetirdi.

## 942-Cİ İLDƏ (02.07.1535 – 19.06.1536) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Belə bir məğlubiyyətdən sonra Ümmət bəy və heratlılar[2114] söz bilən adamları Sufiyan xəlifə Rumlunun yanına göndərdilər və onu [Herata] dəvət etdilər. Sufiyan xəlifə öz yaxınlarını və oğlunu İmam Rzanın müqəddəs Məşhədində qoyub Herata yollandı və sözügedən ilin 4 məhərrəmində (05.07.1535) şəhərə daxil oldu. Mahmud bəy, Ümmət bəy, qazilər və şəhərlilər onu qarşıladılar və o, Bəhram kimi qəhredici qoşunla şəhər bağında dayandı. [Sufiyan xəlifə] yol yorğunluğunu [çıxardıqdan] sonra bədxah adamların sözü ilə yolunu azıb, sitəm əlini rəiyyətə uzadaraq yaramaz [vergi] yazanları və bədnəfəs, gözüdönmüş ələmdarları gənclərə və qocalara müsəllət etdi. O, buğda sünbülündən toxum çıxarıb bir-bir sayırdı və deyirdi:

- Bir buğdadan üç-dörd sünbül hasil olar, hər sünbüldən də bu qədər toxum hasil olar və bu səbəbdən bu miqdar artığınız vardır. İndi gərək bu [artığı] verəsiniz.

[Sufiyan xəlifə] mal-dövlətə sahib olduğunu güman etdiyi şəxsi tələb edib (çağırıb) deyirdi:

- Mən yuxuda gördüm ki, imamlardan[2115] – onlara salam olsun – biri ilə bir məclisdə iştirak edirəm. İmam səni nəzərdə tutaraq mənə dedi ki, filankəsdən bu məbləği alıb qazilərə təslim edərsən. Dedim ki, ya imam, o mənim dostumdur, onu bu məbləği verməkdən və məni bu vəsaiti ondan almaqdan azad etməyini xahiş edirəm. Nə qədər yalvar-yaxar etsəm də, faydası olmadı.

---

[2111] Camebaf – dərzi.

[2112] Əsəs – gecələr şəhər küçələrinin mühafizəsi, əsasən də bazarların və sənətkarlıq-ticarət mərkəzlərinin qorunması ilə məşğul olan və daruğanın tabeçiliyində olan silahlı dəstə idi. Bu dəstənin digər bir adı da ehdas idi. Əsəs dəstəsinin başçısı "əsəsbaşı" və ya "əmiri-əsəs" adlanırdı *(М.Х.Гейдаров. Социально-экономические отношания, с.84-85)*. Şadi Məhəmməd Əsəs Heratda əmiri-əsəs vəzifəsində idi.

[2113] Əlvənd xan Əfşar Kuhi-Giluyə hakimi idi. O, qiyamçılıqda ittiham olunaraq edam edilmişdi *(Seddon, şərhlər, s.266)*.

[2114] Məclis nüsxəsi: "Xəlifə sultan və Xorasan əhli".

[2115] Məclis nüsxəsi: "on iki imamdan".

Bu əsassız söhbəti etdiyi əsnada o səfeh sifətli divanə öz gözlərindən yaş axıdıb elə sözlər deyirdi ki, məclisdə iştirak edənlərdən bəziləri bu yalan[2116] söhbətin doğru olduğuna inanırdılar. Elə həmin an o adamı öz mülazimlərindən birinə tapşırırdı ki, ona işgəncə verib o vəsaiti ondan alsın.

Sufiyan xəlifənin zülmünün xəbəri dinin pənahı olan şaha çatdıqda, onu hakimlikdən çıxarıb o diyarı şahzadə Sultan Məhəmməd mirzə cənablarına verdi və Məhəmməd xan Şərəfəddinoğlunu o cənabın lələsi [təyin] etdi.

**Sufiyan xəlifə Rumlunun Übeyd xan Özbəklə müharibə etməsi və qazilərin məğlubiyyətə uğraması haqqında söhbət**

Bu il Übeyd xan Amudərya çayını keçib İmam Rzanın müqəddəs Məşhədinə hərəkət etdi. Şəhər sakinləri bu xəbəri eşitdikdə, istər kasıblar, istərsə də varlılar qalanın mühafizəsi üçün səy göstərdilər. Sufiyan xəlifənin arvadı o qalanın müdafiəsini elə təşkil etmişdi ki, bundan daha artığını təsəvvür etmək olmazdı. Belə ki, o, gecə-gündüz bürcləri və qala divarlarını gəzib-dolaşırdı. Übeyd xanın qoşunları darvazalar üzərinə döyüşə gəlsələr də, Sufiyan xəlifənin arvadının hökmü altında olan qazilərin və şəhərlilərin əlindən tutarlı zərbələr alıb geri dönürdülər. Hərçənd özbəklər lağımla, oxla, tüfənglə və qala fəthi üçün gərək olan ləvazimatla həmlə etsələr də, onların niyyət oxu məqsəd hədəfinə çatmırdı. Elə ki Sufiyan xəlifə müqəddəs Məşhədin mühasirə edilməsi xəbərini eşitdi, döyüş əzmi ilə Heratdan müqəddəs Məşhəd tərəfə hərəkətə gəldi. O, öz vəkili olan Xızır Çələbini şəhərdə qoydu. Həmçinin cəhalət və nadanlıq öndəri olan Nurəddin Məhəmməd İsfahanini ixtiyar sahibi edərək onu da şəhərdə qoydu və dedi:

- Mənim gəlişimə qədər dörd min Təbriz tüməni məbləğində [vergini] camaatdan alıb saxlayarsan. Əgər bu malın toplanmasına laqeyd yanaşsan, yəqin bil ki, mənim qəzəbimə giriftar olacaqsan.

O, Fuşəncə çatdıqda nəzəri saman xırmanına düşdü. Buyurdu ki, o samandan bir çuval doldurub gətirsinlər. Niyyəti bu idi ki, Übeyd xanı döyüşdə ələ keçirdikdən sonra onun dərisini soyub həmin samanla dolduracaq[2117]. Daha sonra o, köçhaköçlə irəlilədi.

Übeyd xan onun əhvalatından və hərəkətindən agah olduqda fikrə getdi. İstədi ki, onun qarşısına çıxmasın. Çünki [Sufiyan xəlifə] dinin pənahı olan şahın əmirlərindən biri idi və buna görə də [Übeyd xan] onunla şəxsən qarşı-qarşıya gəlməyi özünə ar bilirdi. Bundan başqa, [Übeyd xan] eşitmişdi ki, [Sufiyan xəlifənin] bir dəliliyi vardır, müharibə əsnasında dəliliyi daha da artır və düşmən ordusunun çoxluğundan əndişələnmir; yanında iki-üç min qızılbaş vardır, neçə dəfə özbək qoşununa qalib gəlib və cəsarətlənib. Übeyd xan qoşun başçıları ilə məşvərət etdi. Bəziləri dedilər:

- Əgər Siz dinin pənahı olan şahın əmirlərindən birinin qarşısına çıxmırsınızsa və onun şücaətindən əndişə edirsinizsə, nə üçün Buxaradan çıxıb onun məmləkətini tutmağa gəlmişsiniz? [2118]

Bu sözü eşitdikdə Übeyd xanı qeyrət təri bürüdü və o, Sufiyan xəlifənin düşərgəsi üzərinə yollandı.

O tərəfdən Sufiyan xəlifə özbəklərin bir dəstəsinə rast gələrək onlardan otuz nəfəri qətlə yetirdi və Əbdülabad kəndində dayandı. Əsir olmuş özbək sərdarı ərz etdi:

- Sizin üçün yaxşısı budur ki, dərhal geri dönmək təbilini vurub Herata yollanasınız. Ondan ötrü ki, Übeyd xan dövran hadisələrinin sayından daha artıq bir ordu ilə [buraya] gəlməkdədir və sizin ona müqavimət göstərmək taqətiniz yoxdur. Çünki o, padşahlıq rütbəsinə malikdir, sən isə əmirlik rütbəsinə sahibsən.

Beyt

“Özündən (öz qoşunundan) artıq orduya həmlə etmə,
Çünki barmağı neştərə batırmaq olmaz”.

Lakin qürur pərdəsi [Sufiyan xəlifənin] gözünü bağladığından onun sözünü qəbul etmədi və həmin məkanda qalmağa davam etdi.

Qeyd olunan ilin rəcəb ayının 20-də[2119] (14.01.1536), pəncşənbə gününün səhərində Übeyd xan dövran hadisələrinin sayından artıq bir qoşunla peyda oldu və həmin ordunun mənqəlayı olan Übeyd xanın oğlu

---

[2116] Məclis nüsxəsi: “bihudə”.
[2117] Məclis nüsxəsi: “... öldürəcək və onun başının dərisini həmin samanla dolduracaq”.
[2118] Məclis nüsxəsi: “Hərgah sən şahın əmirlərindən biri qarşısında tənəzzül edirsənsə, onda nə üçün qəlbində şaha qarşı düşmənçilik iddiası edirsən?”

Əbdüləziz sultan və Xarəzm[2120] sultanlarından Əli sultan və Əqəş sultan[2121] göründülər. Sevincək Məhəmməd sultan bir dəstə özbəklə Sufiyan xəlifənin ordusu üzərinə yollandı. Xəlifə onları qarşılamağa tələsdi və Ümman dənizini bir ovuc nəmli torpaqla doldurmaq istəyən, Araz çayını toz-torpaq və çör-çöplə öz məcrasından döndərmək arzusuna düşən bir adam kimi onları dəf etmək məqamına gəldi. Sufiyan xəlifə beş-altı nəfərlə irəli getdi ki, Übeyd xanın qoşununa nəzər salsın. Əli sultan Xarəzmi onun atına bir ox vurub, onu geri dönərək öz qoşununa qoşulmağa məcbur etdi. Übeyd xan mərkəzdən hərəkətə gəlib Sufiyan xəlifənin qoşununa həmlə etdi. Qızılbaş qoşunları qana susamış Bəhram kimi intiqam qılıncını qından sıyırdılar və atəş yağdıran oxu kin zəhəri ilə sulayıb irəli atıldılar. O iki iri qoşun və iki coşqun dəniz bir-birinə qarışdılar. Can alan ox əcəl xəbərini ürəyə çatdırırdı. Cansız əfi ilan, yəni can alan nizə yaralı ürəyi bədəndən ayrılmış ruhun önünə sərirdi.

Nəzm

“Düz nizələr ruzigarın bəlasıdır,
Naşı adamlar kimi əcəl ona süvar olmuşdur.
Əcəl kinli ox vasitəsilə ürəyə yetişdi,
Ruhlar darısqal bədəndən uçub getdi”.

Sufiyan xəlifənin ordusu müqavimət göstərməyə aciz olub fərar etdi. O divanə özünü neçə adamı ilə birlikdə Əbdülabad [kəndindəki] viranəyə saldı. Übeyd xan çoxlu qoşunla viranəni bir mərkəz kimi araya aldı. Həmin viranədə yeyiləcək cinsdən heç nə olmadığı üçün qazilər öz atlarını öldürdülər, yəhərlərini qırıb, odun yerinə yandırdılar və at əti ilə dolandılar. Aləmi yandıran özbəklər otuz beş gündən sonra mövqelərini (“sibə”ləri) irəli çəkdilər və həmlə edərək viranəliyi tutdular. Sufiyan xəlifəni diri-diri Übeyd xanın qarşısına apardılar. Onu Tənişə təhvil verdilər ki, Sufiyan xəlifə ilə döyüşdə öldürülmüş oğlunun əvəzinə qətlə yetirsin.

O vuruşmada iştirak etmiş adamlardan eşidilmişdir ki, Sufiyan xəlifəni Übeyd xanın yanına aparan vaxt özbəklərdən biri onu atının arxasında tutmuşdu. Sufiyan xəlifə öz başını onun arxasında elə gizlətmişdi ki, üzü görünmürdü. Hərçənd Übeyd xanın adamları onun başını qaldırıb üzünü görməyə səy etsələr də, [bu, onlara] müyəssər olmadı.

**Übeyd xan Özbəyin Herat şəhərini Xızır Çələbi Rumludan alması haqqında söhbət**

Sufiyan xəlifə Rumlunun Heratdan getməsindən sonra Nurəddin Məhəmməd İsfahani sitəm qələmini çəkib, rəiyyətdən və digərlərindən hər kimdə ki sərvətin olduğunu güman edirdi, onun müəyyən bir məbləğ ödəməsinin vacibliyi haqqında fərman verərək zalım adamları bu verginin alınması üçün təhsildar təyin edirdi. Buna görə də sadə xalq (“avam camaat”) onun üstünə hücum çəkib onu hamamda ikən qətlə yetirdi. Sufiyan xəlifənin məğlubiyyəti xəbəri Herata çatdıqda Xızır Çələbi və Əmir Həsən Qazı şəhərin [müdafiəsinin] möhkəmləndirilməsinə çalışdılar. Onlar şəhərin və şəhərətrafı bölgələrin (“bölükat”) əhalisini çağırdılar ki, onlarla ittifaqda şəhəri mühafizə etsinlər. [Lakin əhalinin] əksəriyyəti, xüsusən də Xoca Əhməd Ziyarətgahi, onun qardaşı Xoca Mübarək və Xoca Qasım [bu çağırışa] qarşı çıxdılar. Onların müxaliflik etmələrinin səbəbi o idi ki, Sufiyan xəlifə onları asdırmaq üçün Herat çarşısında bir dar ağacı qurdurmuşdu, amma [bu işi icra etməyə] fürsət tapmamışdı. Xoca Mübarək, Xızır Çələbi və Əmir Həsən Qazı ilə kobudluqla söhbət etdi. O zaman şəhər kələntəri olan Mühib Mikal bir gün gizlicə Xoca Əhmədin yanına adam yolladı və xəbər verdi: “Bizə kömək üçün saysız yaraqlarla çoxlu piyadalar göndər ki, Xızır Çələbi ilə Əmir Həsən Qazını ortadan qaldıraq və Übeyd xanı dəvət edib Heratı ona verək”. Bu asilik düşüncəsi neçə gün davam etdi. Axırda peyğəmbərin – ona salam olsun – “İki adamın bildiyi şey sirr deyildir” hədisinə uyğun olaraq, az adamın bildiyi bu sirr kiçikli-böyüklü bir çoxlarına çatdı. Əmir Sultan İbrahim Əmininin oğlu Əmir Əbu-Tahir onların bu iddiasından xəbər tutub, Xızır Çələbinin yanına gedərək əhvalatı ona danışdı. Xızır Çələbi nifaq sahiblərini tələb etmək (çağırmaq) üçün adam göndərdi. Xoca Mübarək fərar etdi, Mühib Mikal isə ələ keçib ən qəbahətli bir şəkildə qətlə yetirildi. Herat əyanları onlarla ittifaqda olmamalarına baxmayaraq, İxtiyarəddin qala-

---

[2119] Məclis nüsxəsi: “2-də”.
[2120] Baroda nəşri: “Özbək”.
[2121] Bakı nüsxəsi: “Abış sultan”.

sında məhbus və ixtiyarsız edildilər. Herat ətrafındakı bölgələrin rəiyyətləri Ziyarətgah sakinləri ilə ittifaqda qiyam qaldırıb, dava-dalaş etməyə hazırlaşaraq Firuzabad darvazasına yönəldilər. Hərçənd Xızır Çələbi elçi göndərib nəsihət etsə də, müxaliflər sülhə razı olmadılar. Şəhərətrafı bölgələrin camaatı zor göstərdi. Bir dəyirmançı darvazaya yaxınlaşıb darvazaya qılınc vurdu. Qazilərdən biri oxla onu yerə sərdi. Dilavərlər qaladan çıxıb iti qılınclarla o fitnənin tozanağını yatırdılar. Nifaq əhli yəqin bildi ki, bu iş onların könlünün istədiyi kimi baş tutmayacaqdır. Onlar arxa çevirib öz məskənlərinə getdilər və Übeyd xanın yanına şirin dilli elçilər göndərib onu dəvət etdilər. Übeyd xanın gəlişinə qədər həddini bilməz bədbəxtlər və məchul basqınçılar darvazanın yaxınlığına gəlib döyüşdülər və qazilərin həmləsi ilə məğlub olaraq məyus və uğursuz bir şəkildə geri çəkildilər.

O əsnada, ramazan ayının 18-də (11.03.1536)[2122] Übeyd xan böyük bir qoşunla və sonsuz bir güruhla Herat ətrafına gəlib Murad bağında ürəyinin muradına uyğun surətdə qərar tutdu. Xızır Çələbi, Ümmət bəyi İraq darvazasında qoydu və özü şəxsən qazilərin bir hissəsindən ibarət süvari dəstəyə sərdar oldu ki, özbəklərin güc gəldikləri tərəfə köməyə getsin. Übeyd xan şəhəri əhatəyə alıb gəliş-gediş yolunu bağladı. Bir gün özbəklər hücum edib xəndək kənarına gəldilər. Qazilər onları tüfəng atəşləri ilə geri oturtdular. Xızır Çələbi və Əmir Həsən Qazı günlərlə dan yeri qızarandan şəfəqin qürubuna və səhər açılandan axşam düşənə kimi düşmənlərlə döyüşdülər. Təxminən üç ay[2123] boyunca o azğın güruh yüksək məqamlı qazilərə müqavimət göstərdi. Axırda Xoş darvazası bürclərindən iki-üç bürcün müdafiəsinə başçılıq edən Sultan İbrahim Əmininin oğlu Əbu-Tahir[2124] xəyanət etdi. Çünki onun Əmir Həsən Qazı ilə münaqişəsi vardı. Elə buna görə də o nadan bədbəxt öz etimadlı adamlarından birini gizlicə Übeyd xanın yanına göndərdi və ərz etdi: “Əgər mənə münasib bir ali mənsəb verərsinizsə, mühafizəsinə başçılıq etdiyim bürcdən sizin adamlarınızı şəhərə daxil edərəm”. Übeyd xan əhd-peyman bağladıqdan sonra onun qasidini yola saldı. Qasid onun yanına gəlib əhdnaməni gətirdi. Sözügedən şəxs əlverişli məqam axtarmağa başladı. Nəhayət, 943-cü ilin səfər ayının 27-si gecəsində (16.08.1536), gecənin 1/3 hissəsi keçdiyi vaxt o səadətsiz bədbəxt, bürcün başındakı şiş ucları viran edib oraya nərdivan qoydu və təxminən üç yüz özbəyi qalaya daxil etdi. Onlar şeypur çalıb darvazaya doğru hərəkət etdilər. Qazilər düşmənlərin [qalaya] soxulmasından agah olduqda onları dəf etmək üçün irəli atıldılar. Çoxlu səydən sonra özbəklər onlara qalib gəlib özlərini darvazaya yetirdilər və darvazanı öz dostlarının üzünə açdılar. Mavəraünnəhr qoşunu hiddətli bir şəkildə şəhərin içinə daxil oldu.

Beyt

“Ətrafdan qoşun daxil oldu şəhərə,
Başları kinlə, ürəkləri hiddətlə dolu idi”.

Onlar bəla tufanını yüksəldib şəhərlilərin mallarını tarac etməklə məşğul oldular.

Şeir

“Hər guşədən qarətpərəst türklər,
Taraca və qarətə əl atdılar.
Qurbanının kəmərindən asılmış,
Bir dərviş çantasını apardı birisi.
Digəri isə ovcunda dənələr və pambıq tutmuşdu sanki,
Bu pambıq sədəf idi, o dənələr bahalı inci idi.
Dərviş kəşkülündən tutmuş qızıl camadək,
Apardılar qarətkar türklər”.

Xızır Çələbi öz adamları ilə İxtiyarəddin qalasına çəkildi. Qiyamət əlamətli özbək qoşunu məhəllələri qarət etməyə başladı. Şəhərətrafı bölgələrin (bölükat) sakinlərinin işarəsi ilə [özbəklər] şəhərlilərin evlərinə daxil olub onların zahiri sərvətlərini mənimsədilər və gizlədilmiş sərvətləri əldə etmək üçün insanlara işgəncə verərək son dərəcə sitəm və zülm nümayiş etdirdilər. Kiçiklərin və böyüklərin naləsi asimana ucaldı. İs-

---

[2122] Bakı nüsxəsində ay və gün yoxdur.
[2123] Məclis nüsxəsi və Baroda nəşri: “bir ay”; London nüsxəsi: “təxminən iki-üç ay”.
[2124] Bakı nüsxəsinin bu yerində “Əbu-Talib” (?) yazılmışdır.

mət[2125] pərdəsinin Zöhrə[2126] alınlıları qulyabanı görünüşlü moğolların əlində giriftar olub bir saat belə rahatlıq tapmadılar.

"Bəsrə xarab olduqdan sonra" (iş-işdən keçəndən sonra) Übeyd xan nəsihətamiz sözlərlə Təniş bəyi şəhərin içinə göndərdi ki, türkləri[2127] müsəlmanları tarac etməkdən çəkindirsin. O, şəhərə daxil olub car çəkdirdi ki, heç kəs tarac etmək və sərvət ələ keçirmək üçün sakinlərin evlərinə girməsin. Buna görə də o şiddət sakitləşdi. Şəhərətrafı bölgələrin sakinləri Əmir Həsən Qazını tutub atəşə atdılar[2128].

Beləliklə, Übeyd xan ali şanlı sultanların əyləşdiyi bir məkan olan Xorasan məmləkətini işğal etdi, qazilərdən və təbərrayilərdən əlinə keçəni qətlə yetirdi. Daha sonra o, İxtiyarəddin qalasının fəthi ilə məşğul oldu və Xızır Çələbi ilə Ümmət bəyin yanına yaxşı nitq qabiliyyətinə malik elçilər göndərdi ki, onları cəza almayacaqlarına əmin edib oradan endirsin. Elçilər xanın adından and içdilər ki, qalanı və Sufiyan xəlifənin mallarını təslim edəcəyiniz təqdirdə heç kəs sizin mallarınıza və ailənizə əl uzatmayacaqdır. Bu səbəbdən İxtiyarəddin qalasında yerləşənlərin bəzisi öz ixtiyarı ilə, bəzisi isə əlacsızlıqdan qala darısqallığını tərk etdilər. O əsnada Übeyd xanın oğlu Məhəmməd Rəhim[2129] bir şər dəstəsi ilə özünü qala əhlinə yetirib qala adamlarının mallarına əl uzatdı. Dərhal Übeyd xan qəfil bir bəla kimi özünü oraya çatdırıb ox yarası ilə [Məhəmməd Rəhimin] adamlarından birini yoxluq yoluna göndərdi (öldürdü). Xızır Çələbi və Ümmət bəy uşaqları və arvadları ilə çılpaq və üryan şəkildə Sultan Hüseyn mirzə mədrəsəsinə gəldilər. Übeyd xan, Xızır Çələbini uşaqları ilə birlikdə Buxara tərəfə göndərdi. Bir müddət sonra isə onları kiçikli-böyüklü qətlə yetirdi. Hər gün cahillərin[2130] sözləri əsasında o imansız xanın hökmü ilə beş-altı nəfər şiəlikdə ittiham edilib Herat çarşısında öldürülürdü. Dinsiz kəndlilər və xəyanətkar şəhərlilər ədavətə malik olduqları adamı tutub qazının yanına aparırdılar ki, bu kişi qızılbaş zamanında Əbu-Bəkri, Öməri və Osmanı lənətləmişdir. Həmin iki cahil şahidin sözü ilə qazı məzlumun qətlinə hökm verirdi. Onu çəkə-çəkə Herat çarşısına aparırdılar və qətlə yetirirdilər. Onların bədşükümlülüyü üzündən möhnət dalğaları və fitnə ləpələri ən yüksək səviyyəyə çatdı, zorakılıq və qarət Xorasanın ətrafına yayıldı.

### Müxtəlif əhvalatlar

Bu il içində dinin pənahı olan şah Təbrizdə qışlaq etdi.

### Ölümlər

Padşah Sultan Xəlil [ibn İbrahim Şeyxşah] ibn Fərrux Yəsar ibn Əmir Xəlululla ibn Əmir Şeyx İbrahim ibn Sultan Məhəmməd ibn Keyqubad sözügedən ilin cəmadiyüləvvəl ayının 9-cu günündə (05.11.1535)[2131] fani məkandan əbədi məkana köçdü və ondan heç bir nəsil qalmadı. Onun səltənət müddəti on iki il olmuşdur və məmləkəti Şirvan vilayəti idi. Onun vəfatından sonra azyaşlı Şahrux ibn Sultan Fərrux ibn Şeyxşah taxta əyləşdi.

Sufiyan xəlifə Rumlunun əsli Sivas şəhərindən idi. Neçə il Xorasanda hakimlik etmiş və dörd min səkkiz yüz[2132] özbəyi döyüşdə qətlə yetirmişdir. Həftənin düşənbə, seşənbə və cümə günlərində ehsanlıq halva üçün on iki batman qənd və qırx batman bal ayırar[2133], bundan başqa, iki yüz kəllə qənd, on iki qoyun və digər ləvazimatlar, həmçinin iki min[2134] dinar hazırlayardı və bütün bunları on iki imam yolunda sərf edərdi. Bu il o, yuxarıda qeyd edildiyi tərzdə öldürüldü.

Xondgarın qoşunları Azərbaycana gəldiyi vaxt Rəşt hakimi Müzəffər sultan nifaq məqsədi ilə öz vilayətini qoyub xondgarın yanına getdi. Rumilərin getməsindən sonra o, Gilana yollandı. Onun yoxluğunda

---

[2125] Baroda nəşri və Bakı nüsxəsi: "iffət".
[2126] Zöhrə – gözəllik rəmzi sayılan Venera planeti.
[2127] Bakı nüsxəsi: "adamlarını". Burada türklər adı altında özbəklər nəzərdə tutulur.
[2128] Məclis nüsxəsi: "... tutub atəşdə yandırdılar və qazilərdən, təbərrayilərdən kimi gördülərsə, qətlə yetirdilər".
[2129] Başqa qaynaqlara görə: "Əbdürrəhim" *(Seddon, şərhlər, s.266).*
[2130] Məclis nüsxəsi: "qərəzli danışan adamların".
[2131] Bakı nüsxəsində ay və gün yoxdur.
[2132] İsgəndər bəy Münşiyə görə: "dörd min yeddi yüz" *(Tarixi-aləmarayi-Abbasi, I c., Bakı, 2009, s.156).*
[2133] Məclis və Bakı nüsxələri: "on iki batman qənd halvası və qırx batman bal halvası".
[2134] Məclis nüsxəsi: "on min". Bakı nüsxəsi: "on iki min".

mülazimi Əmirə Hatəm[2135] Rəşti ələ keçirmişdi. ... mövqeyində[2136] onların arasında olduqca gərgin bir müharibə baş verdi. Əmirə Hatəm ona qalib gəldi və Müzəffər sultan bol-bol kədərlə bir gəmiyə oturub biz müddət dənizin üzündə heyran və sərgərdan dolaşdı. Axırda onun dövlət gəmisi Badikubə (Bakı) ətrafında bəxtsizlik girdabına düşdü. Şirvan valisi Sultan Xəlil onu yanına aparıb ona qayğı göstərmək fikrinə düşdü. Onların hər ikisi dinin pənahı olan şahla qohumluq şərəfinə nail olmuşdular. Lakin onun uğursuzluğundan Sultan Xəlil də həmin vaxt vəfat etdi və o, dinin pənahı olan şahın göndərdiyi adamların əlində giriftar oldu. Onu Təbrizə gətirdilər. O, şəhər ətrafına çatdıqda dinin pənahı olan şah hökm etdi ki, şəhəri bəzəsinlər. Ustalar, sənətkarlar və ortabab adamlar [şəhərə] bəzək vurmaqla məşğul oldular. Bazarları, küçələri və Qeysəriyyəni çeşidli parçalarla və əmtəələrlə bəzəyib süslədilər. Qəvvallar, nakişilər (müxənnəslər), məzhəkəçilər və məsxərəçilər adı çəkilən şəxsi (Müzəffər sultanı) qarşılamağa tələsdilər və ona dəri xələt geyindirib, onu tamamilə lağa qoyaraq şəhərə gətirdilər. Axırda onu dəmir qəfəsə salıb yandırdılar.

Əmir Səədəddin İnayətulla Xuzani fikrinin mətinliyi və tədbirinin doğruluğu ilə digər yüksək dərəcəli vəzirlərdən tam imtiyaza (üstünlüyə) malik idi. O, bu il şahın qəzəbinə düçar oldu. Səbəbi bu idi ki, o, Basliq bəyin oğlu İsa ilə fəsad törətmək arzusunda idi və [bu məqsədinin həyata keçməsi üçün] həmin oğlana müxtəlif hədiyyələr və bəxşişlər vəd etmişdi[2137]. Bu məsələ [hökmdarın] ərzinə çatdı. Buna görə də şahın qəzəb alovu alışdı. O həzrətin hökmü ilə Müzəffər sultan Gilaninin qəfəsə salınıb atəşə verildiyi gün sözügedən xocanı da Müzəffər sultanın qəfəsinin altında xayasından asdılar. Onların ikisini birdən yandırıb vücudlarının külünü fəna küləyinə verdilər. Onların ölüm tarixini [əbcəd hesabı ilə] "Basliq oğlunun eşqindən" [ifadəsində] tapa bilərik.

Şeir

Xoca İnayətulla ki, həmişə
Dəm vururdu müdriklikdən, ağıldan,
Pis əməl törədib mənsəbdən düşdü.
Dedim: "Ey qəmə və möhnətə yoldaş olan!
Eşq qəmindən yaranan bu hadisənin tarixi nədir?"
Dedi: "Basliq oğlunun eşqindən"[2138].

Mövlana Əhli Şirazi bu ildə Şirazda vəfat etdi. Şeiriyyatından Xoca Salman Savəcinin[2139] süni qəsidəsinə cavab və qəzəllər divanı vardır[2140].

## 943-CÜ İLDƏ (20.06.1536 – 09.06.1537) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın dördüncü dəfə Xorasana qoşun çəkməyi

Bu il bir-birinin ardınca Xorasandan elçilər gəldilər və ərz etdilər ki, Übeyd xan əvvəlki kimi düşmənçilik meydanında cövlan etməkdədir. Buna görə də padşahlıq şərəfi və şahlıq qeyrəti [Şah Təhmasibin] qəzəb odunu alovlandırdı. Qəzavü-qədər kimi cərəyan edən bir fərman verildi ki, cahan qoşunları qələbə nişanlı bayraqların kölgəsində Xorasan tərəfə yönəlsinlər və zəlalətli özbək camaatının və şövkətsiz yezidiyyə güruhunun darmadağın edilməsinə, onların kökünün qırılmasına tamam-kamal səy və sözlə ifadəsi mümkün olmayan cəhd nümayiş etdirib o vilayəti onların xəbis və napak vücudundan pak etsinlər. Din mücahidləri və müzəffər qazilər tabeçilik kəmərini bellərinə bağlayıb, "şahdan bir işarə, bizdən isə can-başla əməl etmək"

[2135] İsgəndər bəy Münşi onun adını "Əmirə Xatəm" yazmışdır *(Tarixi-aləmarayi-Abbasi, I c., Bakı, 2009, s.246).*

[2136] Döyüşün baş verdiyi yerin adı bütün nüsxələrdə boş saxlanılmışdır.

[2137] Xoca İnayətulla qeyri-ənənəvi cinsi istəklərə malik idi və həmin oğlana eşq elan etmişdi *(Tarixi-aləmarayi-Abbasi, I c., Bakı, 2009, s.339).* Bəzi qaynaqlarda İsanın adı çəkilmir. Lakin Həsən bəyin izahatından aydın olur ki, bu məsələdə adı hallanan şəxs, əslində, Basliq bəyin özü deyil, onun oğlu İsadır.

[2138] "Ze eşqi-pesəri-Basliq" = 942 h.

[2139] Xoca Salman Savəci (təxm. h. 700-769 və ya 779 / m. 1300-1367 və ya 1378) – Əlaəddin Məhəmmədin oğludur. XIV əsrdə yaşamış, Sultan Həsən və Sultan Üveys dövründə Cəlairilər sarayında məliküş-şüəra vəzifəsini tutmuşdur. Təbrizdə vəfat etmiş və orada basdırılmışdır. Daha çox qəsidə yazmaqda məharəti varmış. Bundan başqa, qəzəlləri, "Cəmşid və Xurşid", "Fəraqnamə" adlı məsnəviləri də vardır *(F.Cahanbəxş. Zindeginameyi-şe'rü-şairani-irani. Tehran, 1384, s.160-161).*

[2140] Əhli Şirazi – əsl adı Məhəmməddir. H. 858 / m. 1454-cü ildə doğulmuşdur. Qəsidələri, qəzəlləri, "Sehri-halal", "Şəm və pərvanə" adlı məsnəviləri vardır. Teymurilərin, Ağqoyunluların və Səfəvilərin sarayını görmüş, bir müddət guşənişinlik etmişdir *(Şeyx Davər Müfid. Təzkireyi-Miratül-füsəha, s.76-78).*

deyərək hərəkətə gəldilər. O həzrət, tərkibindəki sıravilərin və rütbəlilərin sayını hesablamaq baxımından fikrin və xəyalın aciz qaldığı [böyük] bir qoşunla Xorasana yollandı. Əmir sultan Rumlu, Sədrəddin xan Ustaclu və Əli sultan Tatıoğlu mənqəlay şəklində ondan öncə yola düşdülər. Qazi xan Zülqədər Şirazdan, Şahqulu xan Əfşar[2141] isə Kirmandan gəldilər. Həmçinin Hüseyncan sultan Rumlu[2142], Budaq xan Qacar və hər diyarın başçıları hökmdarın ordusuna qoşuldular. Həmin zaman dinin pənahı olan şah Nisa və Əbivərd tərəfə hərəkətə gəldi. Növbəti mənzildə Əmir sultan Rumlu və Şahqulu xəlifə Möhürdar Təbəs qalasına göndərildilər. Çünki Sam mirzə orada idi. Sam mirzə qaladan çıxıb xəcalət başını peşmançılıq yaxasından çıxardı və üzrxahlıq ayağı üzərində dayandı. Əmirlər onu şahın mərhəmət vədi ilə ümidvar edərək aləmin pənahı olan dərgaha gətirdilər. Dinin pənahı olan şah onun bəzi mülazimlərini qətlə yetirib onun günahının üstündən keçdi.

**Dinin pənahı olan şahın Xorasana gəlməsi və Übeyd xanın fərar etməsi**

Übeyd xan on dörd ay[2143] Heratda qaldıqdan sonra İmam Rzanın müqəddəs və nurlu Məşhəd vilayətinin işğalını əmr etdi və böyük əmirlərindən olan Dərviş bəyi Heratda qoyub məqsədinə doğru hərəkətə gəldi. Baxərz vilayətinə çatdıqda eşitdi ki, dinin pənahı olan şah öz məkanından çıxıb Xorasana gəlməkdədir. Bu xəbəri yoxlamaq üçün o, ətrafa adamlar göndərdi. Bu əsnada onun göndərdiyi adamlar gəlib çıxdılar. Onlar məchul bir kişini üzərindəki məktubla birlikdə tutub gətirmişdilər. Həmin məktubu Məşhəd vilayətinin əyanlarından biri Heratdan olan dostlarından birinə göndərmişdi. Məzmunu belə idi: "Filan gün Şah Təhmasib həzrətləri Xorasana gəlmişdir və özbəkləri darmadağın etmək, onların kökünü qırmaq üçün hal-hazırda köçhaköçlə Herata doğru yoldadır". Übeyd xan bu məktubu aparan adamı öz mülazimlərindən birinə tapşırıb, dərhal Baxərz vilayətindən köç edərək Herata gəldi. O, digər bir xəbərin gəlib çatması intizarında idi ki, şaban ayının 16-cı (28.01.1537) gecəsində Mərvi-Şahican vilayətində olan Sevincək Məhəmməd sultanın yanından adam gəldi və onun qaravullarının Dərəgəzdə tutduqları bir qızılbaşı gətirdilər. O şəxs dedi ki, şah həzrətləri Xorasana gəlib və tezliklə Herata da gələcəkdir. Übeyd xan özbək əmirlərini toplayıb danışmağa başladı və dedi:

- Gərək siz öz ordunuzla mənə yardım edəsiniz, biz burada qalaq və qızılbaşlar gəlib çatdıqları vaxt [onlarla] müharibə edək. Ehtimal ki, bu dəfə biz qalib gələrik. Çünki onlar qışın ortasında öz məkanlarından çıxmışlar, Nisa və Əbivərddə çox zəhmət çəkmişlər və onların ləvazimatı zay olmuşdur. Biz ordumuzun kəmiyyəti və yaraq baxımından onlardan üstünük.

Özbək əmirləri ərz etdilər:

- Heratdan köç edib Buxaraya getməyimiz lazımdır.

Nəzm

"Bizdə şahla savaşmaq taqəti yoxdur,
Qələbə və zəfər şahın tərəfindədir.
Fələk onun yarıdır, ulduzlar onun tərəfdarıdır,
Tüfəng şimşəyi çaxdıqca onun bazarı qızışır.
Onunla vuruşmağa bizim macalımız yoxdur,
Qaçmaqdan başqa çarəmiz yoxdur bizim.
İldırıma qəzəb üzündən yumruq atma,
Səbəbsiz yerə öz barmağını yandırma".

Übeyd xan bu cavabı rədd edib qalmaqda israr etdi. [Lakin] faydası olmadı. Özbək əmirləri və sərdarları dedilər:

- Bu işdə bizimlə həmrəy olsan, lap yaxşı. Əks təqdirdə səni tutub, ata bağlayaraq Mavəraünnəhrə apararıq.

[2141] Məclis nüsxəsi: "Şahqulu sultan Əfşar".
[2142] Məclis nüsxəsi: "Hüseynxan sultan Rumlu".
[2143] Məclis və Bakı nüsxələri: "dörd ay".

Übeyd xan bu səbəbdən şaban [ayının] 17-də (29.01.1537), günəş Dolça bürcündə olduğu zaman qaçış atına minib, ağlar və nalan şəkildə Heratdan fərar edərək zəfər şüarlı qoşunların qorxusundan qeyri-ənənəvi [bir yol] olan Bəlx yolundan Buxaraya yollandı.

Beyt

“Günəş nurlarının dağ arxasından baş qaldırdığı zaman,
Bəlli oldu ki, Sühanın[2144] rövnəqi nə qədər imiş”.

Onun fərar etməsindən sonra dinin pənahı olan şah Saqi-Salmanda cah-calalla dayandı. Ertəsi gün elə bir əzəmət və həşəmətlə xiyaban yolundan [Herat] şəhərinə gəlib Xorasan taxtına elə əyləşdi ki, qoca fələyin gözü heç bir cavanbəxti o görkəmdə görməmişdi.

Beyt

“Xorasan mülkünə yüz qovğa ilə,
Gəlib çatdı müzəffər şahənşah.
Xorasan torpağı gözəllik və zinət tapdı,
Mülkün bədəni onun gəlişindən təzə can tapdı”.

Mərhəmət günəşi [Şah Təhmasib] öz ədalət dövlətinin kölgəsini dinc əhalinin və rəiyyətin üzərinə saldı. Möhnət səhrasının susuzlarına, əziyyət və məşəqqət temmuzunun (iyulunun) isti vurmuşlarına çevrilmiş o diyarın sakinləri onun fəzilət bulağından ehsan şərbəti içdilər.

## Dinin pənahı olan şahın Zəmindavər və Qəndəhar tərəfə qoşun çəkməyi və o diyarın fəth edilməsi

Elə ki qış fəsli başa çatdı, yaşıllıq və çiçəklik ordusu torpağın xalçasına naxış vurdu.

Nəzm

“Açıldı güllər dəbdəbə və şövkətlə,
Lalə ilə doldu çölün, dağın ətəyi.
Laləgülü gözəllərin ləl dodağına bənzəyirdi,
İşrət ilə gülgün qədəhlər əllərdə idi”.

Ali mənşəli padşah Qəndəhar yürüşü niyyəti ilə Heratdan hərəkətə gəlib, Sultan Məhəmməd mirzə ilə Məhəmməd xanı Heratda qoydu və sözügedən ilin 10 zilqədəsində (21.04.1537) qalibiyyətli hökmdar sürətlə Qəndəhar tərəfə yönəldi. Hilmənd çayının kənarı səadətli padşahın dayanacaq yeri olduqda əmirlərin və əsgərlərin bəziləri öz tayfaları ilə birlikdə sallarla [çayı] keçdilər. Hökmdar fərman verdi ki, Əmir sultan Rumlu çoxlu qoşunlarla Qəndəhara yollansın və o şəhəri [tutub] mühafizə etsin. Buna görə də Əmir sultan yola düşdü. Xoca Kəlan zəfər nişanlı qazilərin gəlişindən xəbər tutduqda, öz qohumlarından və etimadlı adamlarından olan Kiçi Xocanı[2145] Qəndəharda qoyub Sind vilayətinə yollandı.

Ali mənşəli hökmdarın zərnigar tuğunun ayparası Qəndəhar üfüqündən doğduqda Kiçi Xoca və əyanlar onu qarşılamağa tələsdilər və Fəridun kimi şövkətli hökmdarın nəzəri qarşısına gəldilər. O diyarın əyalət hakimliyi Budaq xan Qacara tapşırıldı. O həzrət (Şah Təhmasib) Herata qayıtdı.

[Dünyanın insanla] məskunlaşmış ¼ hissəsinin padşahı Qəndəhar yürüşündən çoxlu qənimətlə Herata gəldikdən sonra Übeyd xanın və Bəlx hakimi Kəskən Qaranın elçiləri dərgaha gəlib hüsn-rəğbətlə qarşılandılar və öz diyarlarına geri döndülər.

## Müxtəlif əhvalatlar

Həmçinin bu il Çingiz xan övladlarından olan Din Məhəmməd xan ibn Üveys xan[2146] və qardaşı Əli sultan ağlın irşadı və səadətin dəlaləti ilə itaət kəmərlərini bellərinə bağlayıb dinin pənahı olan şahın dərgahı-

---

[2144] Süha – Kiçik Ayı bürcündə görünən kiçik bir ulduz. Burada Həsən bəy Rumlu, Şah Təhmasibi dünyanı nurlandıran parlaq günəşə, Übeyd xanı isə zəif işıq saçan kiçik Süha ulduzuna bənzədir.

[2145] Bu adı “Keçi Xoca” kimi də oxumaq mümkündür. İsgəndər bər Münşiyə və Bakı nüsxəsinə görə isə: “Gənci Xoca” *(Tarixi-aləmarayi-Abbasi, I c., Bakı, 2009, s.159).*

[2146] Nuruosmaniyyə, Ellis və Bakı nüsxələri: “Üləş xan”. Bu adı həmçinin Ulaş xan kimi oxumaq mümkündür. Bəzi qaynaqlarda isə Uluş xan və Anuşa xan şəklində yazılmışdır *(Seddon, şərhlər, s.267).*

na gəldilər. O həzrət Nisa və Əbivərd ölkəsini ətraf ərazilərlə birlikdə ona (Din Məhəmməd xana) verib onu o vilayətə göndərdi.

Yenə bu il dinin pənahı olan şahın Herata və Xorasana getməsindən öncə Bəhram mirzəyə Gilan hakimliyini [verib onu oraya] göndərdilər. Mirzənin Gilana getməsinin səbəbi odur ki, Gilan valisi Karkiya Sultan Həsən Tanrının rəhmətinə qovuşduqdan sonra Sultan Həsənin vəkili Kiya Xurkiya Talqani aləmin pənahı olan dərgaha gəldi və Gilan vilayətinə bir hakim təyin edilməsini xahiş etdi. Dinin pənahı olan şah, Bəhram mirzəni çoxlu qoşunla Gilana göndərdi. Mirzə əbləhlərin məsləhəti ilə altı ay Deyləmanda qaldı və o vaxt Kiya Xurkiya igidlik əlamətli bahadırlardan beş yüz nəfərlə Əşkur yolundan qəflətən özünü Lahicana saldı. Bəhram mirzə aləmi yandıran qoşunla elə həmin gün Lahicana daxil oldu. Gilan əmirlərindən on səkkiz nəfər şahzadənin dərgahına gəldi. Mirzə o diyara gəldikdən sonra həmin vilayətin əksəriyyəti onun hakimiyyəti altına keçdi. O əsnada mirzə cənabları gilanlılar arasında tam etibar sahibi olan Kiya Xurkiya Talqanini hərcayi adamların sözü ilə həbs etdirdi və bu səbəbdən gilanlılar qazilərə qarşı müxaliflik etməyə başladılar. Bəhram mirzə məğlub olub Dəryarək yaylağına[2147] gəldi. Neçə gündən sonra o, Qəzvinə gəldi. Bu sətirlərin müəllifi Həsən Rumlu o vaxt Qəzvində idi və həmin şəhər tiyul kimi onun babası Əmir sultana[2148] məxsus idi. Anamla birlikdə [Bəhram mirzəni] qarşılamaq mərasimini və təzim etmək şərtini yerinə yetirdik, peşkəş kimi xeymə, alaçıq, saray pərdəsi, bargah çadırı, nağd pul, yaxşı atlar, qumaşlar və dəyərli mallar təqdim etdik. Böyüklər və əyan-əşrəflər dua etmək və bəxşiş vermək vəzifəsini icra etdilər.

Yenə də bu il dinin pənahı olan şah, Əmir Müizzəddin Məhəmməd İsfahanini sədarətdən çıxarıb, onu Şüştər seyidlərindən olan Əmir Əsədulla Mərəşi ilə əvəz etdi.

### Ölümlər

O vaxt baş vermiş hadisələrdən biri də Xoca Kəlan Quryaninin qətlidir. Sözügedən şəxs əhli-sünnətin ifratından idi. Übeyd xan Quryana gəldikdə, Xoca Kəlan bəzi əbləhlərlə [onu] qarşılamağa çıxıb, onun başına dolandı və bu beyti söylədi:

Beyt

“Əgər məni daş kimi torpağa atsan, qapının torpağı olum,
Əgər məni toz kimi küləyə versən, sənin başına dolanım”.

O, habelə dinin pənahı olan şah haqqında ədəbsiz sözlər dilə gətirdi. Dövlətsevər xəbərçilər və doğru deyən sədaqətlilər həmin əhvalatı [Şah Təhmasibə] ərz etdilər. Buna görə də [Xoca Kəlan Quryaninin] qətli haqqında ali hökm verildi. Fərman icraçıları onu çəkə-çəkə Herat çarşısına aparıb, dərisini soyaraq saman təpdilər və bir çubuğun üzərinə dikdilər.

Bu il Karkiya Sultan Həsən ibn Karkiya Sultan Əhməd ibn Sultan Həsən ibn Karkiya Sultan Məhəmməd ibn Nasir Kiya ibn Əmir Seyid Mehdi taun xəstəliyindən hərəkət bayrağını axirət aləminə doğru qaldırdı (vəfat etdi). İxtiyar sahibi Əmir Abbas onun yerinə bir yaşlı oğlu Xan Əhmədi hökumət [kürsüsünə] əyləşdirdi.

## 944-CÜ İLDƏ (10.06.1537 – 29.05.1538) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Xorasandan qayıtması

Xorasan məmləkətinin işləri dövlətsevər bəndələrin məramına uyğun həll edildikdən sonra dinin pənahı olan şah dövlət və səadət yüyənini səltənət taxtına və xilafət məkanına doğru çevirdi. Onun uğurlu qədəmlərinin təntənəsi Keyvan eyvanına gedib çatdı. Cəmadiüssani [ayının] əvvəllərində səadətin və xoşbəxtliyin zatı (Şah Təhmasib) Tehran ətrafında dayandı. Orada Əmir Qivaməddin Nurbəxşin həbsi haqqında hökm verildi.

Bu əhvalatın təfsilatı belədir ki, Şah Qivaməddin Nurbəxş əbədi həyat xələti olan dərvişlik paltarını əynindən çıxarıb, ayağını öz həddindən kənara qoyaraq ali mənşəli padşahların və iqtidar sahibi xaqanların

[2147] Dəryayek (Dəryavək) yaylağı – Qəzvin yaxınlığındadır *(Seddon, şərhlər, s.267).*
[2148] Baroda nəşri: “Əmir sultanın əcdadına”; Məclis nüsxəsi: “Əmir sultanın atasına”.

üsulu ilə rəftar edirdi. Gecə-gündüz ov itləri ilə ovda idi, kəsralarla qeysərlərin[2149] qaydasına uyğun şəkildə öz evinin qapısında haciblər saxlayırdı və bunlar insan fərdlərindən heç bir fərdə onun məclisinə daxil olmaq imkanı vermirdilər. Əgər hər kim onun azacıq xoşuna gəlməyən bir iş törətsəydi, gecə ikən onun üstünə bir dəstə göndərib qətlə yetirərdi.

Beyt

“Hərgah ruzigar bir kişini bəxtiqara edərsə,
O nə qədər səy göstərsə də, işə yaramaz”.

Hökmdar ordusu təzimi vacib olan Həzrət Əbdüləzimin imamzadəsi ətrafında dayanan vaxt [Şah Qivaməddin] aləmin pənahı olan dərgaha gəlib bütün əmirlərdən, seyidlərdən, məvalilərdən və digərlərindən irəli keçdi. Rey əhli illərlə onun zülmünün təpiyi altında qalmış, canları ağızlarına gəlmiş, bıçaq sümüyə dirənmişdi. Bu səbəbdən onlar ondan şikayət etdilər. Əvvəlcə öz idrakının məziyyəti və kəlamının şirinliyi ilə zəmanə böyüklərindən üstün və müstəsna olan fəzilət sahibi Qazı Şükrulla oğlu Qazı Məhəmməd danışmağa başlayıb söylədi:

- Ey Şah Qivaməddin! Siz padşahsınız, ya dərviş?

O, cavab verdi:

- Mən dərvişəm.

Qazı həzrətləri buyurdu:

- Qala qurmağınızın, cəbbə və cövşən cəm etməyinizin səbəbi nədir?

O, susmağı üstün tutdu. Qazı yenə dilləndi:

- Siz qan tökməkdə elə bir həddə çatdınız ki, cahan sakinləri Übeyd xanla Cəllad Qasımı unutdular.

Və qazı onun qılıncı ilə öldürülmüş adamların adlarını sadalamağa başladı. Elə ki Mövlana Ümidiyə[2150] çatdı, [Şah Qivaməddin] bunu inkar etdi. Dinin pənahı olan şah buyurdu:

- Əgər siz onu qətlə yetirməmişsinizsə, onda nə üçün əmlakını mənimsəmişsiniz?

O əsnada hökmdar ordusunun xəbərçisi olan Mir Feyzi dedi:

- Sənin nə həddin var ki, Seyid Məhəmməd Kəmunənin oğlundan yuxarı başa keçirsən?

Dinin pənahı olan şah buyurdu:

- Doğru deyirsən. Qalx, bura sənin yerin deyildir!

Çoxlu söz-söhbətdən və saysız mübahisədən sonra o həzrətə günəş kimi aydın oldu ki, [Şah Qivaməddinin] iddiası yalandır və seyidliyi qeyri-dürüstdür. Buna görə də onun həbsinə dair ali hökm verildi və neçə gün Qazı Cahanın evində məhbus olduqdan sonra Əlincəq qalasına göndərildi.

Rəcəbin (04.12.1537 – 02.01.1538) əvvəlində Qəzvinin havası səadətli şahın atının ayağından çıxan toz səbəbindən ənbər qoxusu verdi. Orada neçə gün xoşbəxtliklə qaldılar. Şabanın (03.01-31.01.1538) ortasında aləm sakinlərinin hökmdarı darüssəltənə Təbrizə gəldi.

## Əmirlərin Usta qalası üzərinə getməsi, o hüdudun fəth edilməsi və yaramaz Xoca Kəlanın giriftar olması

Xoca Məlik Xafinin oğlu Xoca Kəlan o diyarın qalalarından biri olan və Usta (və ya Asta)[2151] adı ilə tanınan qalada oturmuşdu və gələnə-gedənə hücum edirdi. Bunun üçün [Şah Təhmasib tərəfindən] ali əmr verildi ki, Qazi xan Zülqədər, Şahqulu sultan Əfşar və Əli sultan Tatıoğlu xeyli qoşunla o qalanın fəthinə yollansınlar. O fərmana uyğun olaraq, əzəmətli qazilər qalaya doğru yola çıxdılar.

Elə ki qalanın ətrafı ulduzlar kimi ehtişamlı qoşunların çadırlarının qurulduğu yer oldu, qazilər qalanı tutmaq üçün hazırlıqlara başladılar. Ora elə bir qala idi ki, başı fələklər fələyinə çatırdı və ruzigarın gözü onun mislini görməmişdi. Onun bürcünün şiş ucları yer səthindən ucalaraq yüksək asimandan baş qaldırırdı və möhkəm divarı İsgəndər səddi ilə tən və bərabər olduğunu iddia edirdi.

Şeir

[2149] “Kəsralar” adı ilə qədim İran şahları, “qeysərlər” termini ilə Rum (Roma-Bizans) hökmdarları nəzərdə tutulur.

[2150] Baroda nəşrində Mövlana Ümidinin adı çəkilmir.

[2151] İsgəndər bəy Münşiyə görə Astar (Əstar), Şərəf xan Bidlisiyə görə Ustad, Ç.N.Seddona və Bakı nüsxəsinə görə isə Usta qalası. Bu qala Baxərzdə yerləşirdi. Xoca Kəlan isə Xaf (Xəvaf) məlikzadəsi idi *(Seddon, şərhlər, s.267).*

“Qapısı İsgəndər səddi ilə əkiz idi,
Hasarı fələk bürcünə tay idi.
Əgər onun zirvəsindən bir daş aşağı diyirlənsəydi,
O yalnız qiyamət günü yerə çatardı.
Simurq Qaf dağının ətəyində təvaf etdiyi kimi,
Qoç bürcü onun xəndək ətrafındakı torpağını təvaf edirdi.
Zəfər yüklü, qələbə şüarlı ordu,
O hasarın ətəyində oturdu”.

Üç ay müddətində səhərdən axşamacan döyüş atəşi alovlandı və can alan tüfəng şöləsi dilavərlərin həyat xırmanını yandırdı.

Beyt

“O kin çölündəki tüfəng şimşəyindən,
Yer və göy ildırımla doldu”.

Həmin vaxt Xoca Kəlanın etimadlı adamlarından biri inciklik üzündən qaladan fərar edib əmirlərin yanına gəldi və onlara ərz etdi:

- Bu qalaya bir yol var və oradan qalaya girmək mümkündür. Bu yolu məndən, Xoca Kəlandan və onun iki nəfər digər etimadlı adamından başqa heç kəs bilmir. Məsləhət budur ki, bu gecə qalaya hücuma keçəsiniz və qala müdafiəçilərini özünüzlə məşğul edəsiniz. Bir dəstə [əsgəri][2152] isə mənə yoldaş edəsiniz ki, qalanı fəth edək.

Əmirlər Əli Bayatı bir dəstə qazi ilə o şəxsə yoldaş edib göndərdilər və qoşunun qalan hissəsi döyüşə atıldı. Qorxunc qazilər və dağ görkəmli igidlər bir göz qırpımında özlərini qalaya saldılar və şeypur çaldılar. Qala əhli qətiyyən xəyal etmədikləri bu haldan agah olduqda, sərsəm olub can qorxusundan ox və kamana əl atdılar. Xoca Kəlan qazilərdən iki-üç nəfəri qətlə yetirdi. Axırda zəfər şüarlı qoşunlar o bədbəxt mərdimazarı əlibağlı aşağı endirdilər. Onun mülazimlərini gedər-gəlməzə göndərdilər, Xoca Kəlanın özünü isə Təbrizə yolladılar. Gözəl xilqətli şahın nəzəri o pis etiqadlıya düşdükdə buyurdu ki, onu Nəsriyyə[2153] minarəsindən xayasından assınlar və tam məşəqqətlə cəza məkanına (axirətə) yollansın.

## Şirvanda baş vermiş hadisələr

Bu il bir qələndər Şirvanda iddia etdi ki, “mən Şeyxşahın oğlu Sultan Məhəmmədəm”. O, çoxlu qoşun toplayıb Salyanı ələ keçirdi və oradan Şamaxıya gəldi. Müqavimət qüdrətinə malik olmayan Şahrux fərar edib Biqurd qalasına getdi. Qələndər Şamaxını ələ keçirib neçə gündən sonra səbəbsiz yerə geri qayıdış bayrağını qaldırdı.

Elə ki Şahrux Biqurd qalasında qələndərin çıxıb getdiyini eşitdi, onun arxasından yola düşdü. Salyan ətrafında qoşunlar bir-biri ilə qarşılaşdılar. Döyüş və vuruşdan sonra qələndər məğlub olub aradan çıxdı. Şahrux arxasından gedib onu ələ keçirdi. Şeyx Padar çomaq zərbəsi ilə o nifaq əhlinin sərdarını gedər-gəlməzə göndərdi.

## Müxtəlif əhvalatlar

Mövlana Rüknəddin Məsud Kazeruni zəmanə alimlərinin ən biliklisi və əsrin təbiblərinin ən fəzilətlisi idi. O, bəzən xəstəlik müalicəsində həkimlərin qaydalarının və təbiblərin qanunlarının ziddinə hərəkət edərdi və müalicəsi [məqsədə] müvafiq olardı. Bundan başqa, o, dövlət işlərinə də müdaxilə edərdi. Bu il sədarət vəzifəsini tutan Həzrət Əmir Müizzəddin Məhəmməd İsfahaninin könlündən bir arzu keçmişdi və bu məsələni yalnız ali əşrəfin (Şah Təhmasibin) ərzinə çatdırmaqla həll etmək mümkün idi. Həkim bunu məxfi

[2152] Baroda nəşrində səhvən “bir qorçunu” yazılmışdır.
[2153] Baroda nəşrində yanlış olaraq “Misriyyə” yazılmışdır. Nəsriyyə məscidi Təbrizdə Əbu-Nəsr ləqəbinə malik Uzun Həsən tərəfindən tikdirildiyi üçün bu adı almışdı *(Nəvai, şərhlər, s.1256).*

şəkildə [şahın] izzət və calal qulağına çatdırdı. Buna görə də hökmdarın könlünün aynası o hadisədən tutuldu və o, həkimi yandırdı, Əmir Müizzəddin Məhəmmədi isə sədarətdən çıxardı[2154].

Bu il Mirzə Kamran çoxlu qoşunla Hind vilayətindən Qəndəhar ətrafına gəldi. O, Qaraca bəyi mənqəlay [təyin] etdi. Budaq xan Qacar o zaman öz mülazimlərindən olan Şahverdi bəy Ziyadoğlunu igidlik meydanının atlılarından ibarət bir dəstə ilə onların qarşısına göndərdi. Şahverdi bəy az adamla şəhər ətrafında Mirzə Kamrana çatdı və xeyli döyüşdən, vuruşdan sonra əsir düşdü. Bu səbəbdən Budaq xan sülh və barışıq təklif etdi və əhd-peyman bağlandıqdan sonra Qəndəharı Mirzə Kamrana təslim edib aləmin pənahı olan dərgaha yollandı. Mirzə Kamran da Şahverdi bəyə tam ehtiram göstərib onu azad etdi.

### Xoca Məhəmməd Saleh Bitikçinin Astarabadda qiyam qaldırması və onun Sədrəddin xanın mülazimlərinin əlində giriftar olması haqqında söhbət[2155]

Bu il Xoca Müzəffər Bitikçinin oğlu Məhəmməd Saleh[2156] başını itaət boyunduruğundan çıxardı və üzünü tabeçilik qibləsindən çevirdi. O, Astarabad siyahpuşlarından bir dəstə toplayıb Astarabad vilayətinin qəsəbələrindən bəzilərini ələ keçirdi və Xarəzmə, Ömər Qazi sultanın yanına bol-bol töhfələrlə qasidlər göndərib yardım istədi, özünü onun tərəfdarları zümrəsinə aid etdi. Astarabad üzərində hakimiyyəti ələ keçirmək fikri Xarəzm hakiminin xoşuna gəldi. O, tayfalardan və səhra sakinlərindən xeyli ordu cəmləşdirib Astarabada yollandı. Məhəmməd Saleh Cürcan cəngəlliyindən çıxıb Ömər Qazi sultana qoşuldu. Xarəzmlilər izzət və ehtiram şərtlərini yerinə yetirdilər. Elə ki Astarabad vilayətinin valisi Sədrəddin xan Ustaclu həmin iki sərdarın ittifaqından agah oldu, öz adamları ilə məşvərət etdi. O camaatın hamısı söz birliyi ilə ərz etdi ki, düşmənin sayı xeyli çox, bizim ordumuz isə son dərəcə az olduğu üçün Astarabadı tərk edib Bistama yollanmağımız və dinin pənahı olan şaha məlumat verməyimiz münasibdir. Sədrəddin xan mülazimlərin məsləhəti ilə Bistama yollandı. Məhəmməd Saleh Astarabadın içinə dəbdəbə ilə daxil olub hökumət kürsüsünə əyləşdi, Ömər Qazi sultana və digər özbəklərə layiqli hədiyyələr və müvafiq töhfələr verdi. Ömər Qazi sultan həmin diyarın idarəçiliyini ona verib Xarəzmə yollandı.

Özbəklərin getməsindən sonra [Məhəmməd Salehin] beynini hökmdarlıq sevdası istila etdi və onun başının balqabağı qürur şərabı ilə doldu. O, başından abır-həya külahını utanmazcasına götürdü, ağıldan bir tük qədər bəhrəmənd olmayan beyinsiz başını qəşəng tacla bəzədi və bəsirət nurundan nəsibsiz olan gözünü və ürəyini şuxluq sürməsi ilə cilaladı. O əbləhlər rəhbəri eyş büsatı qurdurdu.

İnanılmış adamlardan eşidilmişdir ki, həmin günlərdə o nadan cahil [dünyanın insanla] məskunlaşmış ¼ hissəsinin şəhərlərini boş fikirli həriflər və öz yaxınları arasında paylaşdırırdı. Hansısa bir vilayəti əbləhlərdən birinə namizəd etdiyi zaman o ağılsız onun qarşısında səcdə edib onu dua etmək üçün ağzını açırdı. Məşhurdur ki, onun mülazimləri arasında [dünyanın insanla] məskunlaşmış ¼ hissəsini bölüşdürmək üstündə böyük bir dava baş vermişdi.

Sədrəddin xan Astarabaddan çıxıb gedəndən sonra o əhvalat haqqında dinin pənahı olan şaha xəbər göndərdi. O həzrət əmr etdi ki, Əmir sultan Rumlu, Şahqulu sultan Ustaclu, Hüseyncan sultan Rumlu və Həsən[2157] bəy Şamlu onun üzərinə getsinlər. Əmirlər dinin pənahı olan şahın fərmanı ilə yola düşdülər. Onların çatmasından öncə Sədrəddin xan təvəkkül cövşənini geyinib, ruzigarın istisini-soyuğunu görmüş təcrübəli bahadırların bir dəstəsi ilə Bistamdan Astarabad tərəfə sürətlə yürüyərək mübarək ramazan ayında (01.02-02.03.1538) Tanrının köməyi ilə o vilayətin ətrafına yetişdi. O, şücaətlilərdən ibarət bir dəstəni mənqəlay [təyin] etdi və özü də şəxsən tam sürətlə onların ardınca yola düşdü. O zaman Məhəmməd Saleh islaholunmaz adamlarla ney [səsinə] qulaq asmaqla və yeyib-içməklə məşğul idi. Qəflətən onun qulağına nağara və şeypur

---

[2154] "Farsnameyi-Nasiri"də bu hadisə aşağıdakı kimi təsvir edilir: "943-cü ilin məhərrəm ayının 8-də (27.06.1536), şənbə gününün axırında zəmanə təbiblərinin ən biliklisi olan Molla Rüknəddin Həkim Kazeruni [Şah Təhmasibin] izzət və calal qulağına çatdırdı ki, Əmir Müizzəddin Məhəmməd Sədr İsfahaninin könlünə ulu Səfəvi sülaləsi ilə qohum olmaq arzusu düşüb və o, şahzadə Sultanımla evlənmək istəyir. Elə ki üfüqlər hökmdarı bu sözü Molla Rüknəddindən eşitdi, onun əhvalı pozuldu. O, Əmir Müizzəddini vəzifədən çıxardı və Molla Rüknəddinə qəzəblənib, o biçarənin yandırılması haqqında fərman verdi" *(Nəvai, şərhlər, s.1257).*

[2155] Baroda nəşrində 945-ci il hadisələri buradan başlayır.

[2156] İsgəndər bəy Münşiyə görə Məhəmməd Saleh, Xoca Müzəffər Bitikçinin qardaşı oğludur, Qazı Əhməd Qəffariyə görə isə nəvəsidir *(Seddon, şərhlər, s.268).*

[2157] Bakı nüsxəsi: "Hüseyn".

səsi gəldi. O mərdimazar sərsəm şəkildə fərar yolunu tutdu və meşəyə yönəldi. [Sədrəddin] xanın mülazimlərindən olan Şahverdi bəy Kəngərlü onu ələ keçirib gətirdi. Sədrəddin xan öz məkanında qərar tutdu.

İnanılmış adamlardan eşidilmişdir ki, Herat qazılarından birinin nikahında olan bir seyid qadın öz ərindən uzaq düşmüşdü və anası ilə o vilayətdə (Astarabadda) yaşayırdı. Bir gün anası vəfat etdi. O, anasının vəfatı səbəbi ilə qara geyinmişdi, bir dəstə arvad onun başına yığışmışdı və ağlaşırdılar. [Məhəmməd Salehin] buyruğu ilə həmin matəmli qadının əlini tutub onu o dəhşətlə dolu məclisdən çıxardılar və evə aparıb ona təcavüz etdi. Amma bu qəbahətlərinə baxmayaraq, bol-bol səxavət nümayiş etdirirdi, alimlərə və şairlərə çox ehtiram göstərirdi. Mövlana Heyrəti Astarabadda onun yanına gedərək bu qəsidəni onun adına deyib təqdim etmişdi:

Beyt

“Sənin bayrağın qeybi göstərən aynadır,
Qəlbimizdə nihan olan sənin yanında əyandır.
Ey səadət ölkəsinin xosrovu Məhəmməd Saleh,
Başdan-ayağa bəzənməyin Tanrının lütfüdür.
Sənin qəzəb küləyin əsən zaman,
Dağ badi-səbadan yüz qat artıq lərzəyə gəlir”.

Bu qəsidənin əvəzində o, [şairə] yeddi xərvar ipəklə yeddi qatır verdi. Sədrəddin xan o bədbəxtlik əhlinin başçısını əsir edib dinin pənahı olan dərgaha göndərdikdə, Təbrizə çatdığı vaxt onun dilindən ədəbsiz sözlərin səslənməməsi üçün qazilər o qaragünün dilinə çuvalduz vurub onu danışmaq qabiliyyətindən məhrum etdilər və onu şah həzrətlərinin cəza təsirli nəzəri qarşısına gətirdilər. Müzəffər padşah buyurdu ki, o yaramazı bir küpün içinə qoyub Nəsriyyə minarəsinin başına aparsınlar və [oradan yerə] atsınlar. Fərman icraçıları hökmü yerinə yetirərək dərhal o bəd əməl sahibini o biri dünyaya göndərdilər.

## 945-Cİ İLDƏ (30.05.1538 – 18.05.1539) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Şirvan üzərinə qoşun göndərməsi və bəd aqibətli Şahruxun giriftar olması

Bu il dinin pənahı olan şaha [belə bir] xəbər çatdı: “Şirvan əyanları Sultan Fərruxun oğlu Şahruxun iqtidarsızlığından bezmiş və təngə gəlmişlər. Əmirlər onun razılığı olmadan namus pərdəsini cırırlar və onun başsız ordusu nə istəyirsə, götürüb aparır[2158]. O diyarda şəriət qaydaları laxlamış və xeyriyyə mərkzələri (“büqaül-xeyr”) rövnəqsiz və məəttəl qalmışlar. Bundan başqa, onların fəaliyyəti nəticəsində işlərin nizamı pozulmuş, camaatın asayişi alt-üst olmuş, cəmiyyət və rifah qanunları düzgün səmtdən və doğru yoldan sapmışdır. Hər kəs öz qolunun gücünə güvənib öz tabeliyindəkilərə cürbəcür sitəmlər və acılar çəkdirir”.

Şeir

“Yetərincə qoca və qədim xanədanlar vardı ki,
Möhkəm sütun əsasına söykənmişdilər.
Çərxi-fələyin zirvəsindən bir zərbə gəlmiş,
Söykəndikləri sütun qəflətən yer altına qərq olmuş.
Onların tavanı paya (paz) kimi səcdəyə düşmüş,
Abdal dərvişlər kimi sütunlarının beli bükülmüş.
Rəhbərləri qəndil kimi asılmış,
Mehrabları səccadə kimi yerə sərilmiş.
Onların hünər ağacı maral buynuzu kimi,
Yarpaqsız və cücərtisiz qalaraq solmuş.
Dəyərlinin işi tənəzzülə uğramış,
Dəyərsizin ayağı yuxarı çıxmağa başlamış”.

Buna görə də ali fərman verildi ki, Əlqas mirzə, Məntəşa sultan Ustaclu, Sevindik bəy Qorçubaşı, Bədir xan Ustaclu, Yaqub sultan Qacar, Qara Vəli Ərəbgirlü, Məhəmməd bəy Talış, Qarabağ və Muğan or-

[2158] Baroda nəşri: “və sipahilər nə istəyirlərsə, soruşmadan götürüb aparırlar”.

dusu və müzəffər qoşunlardan iyirmi min [nəfər] o zaman Şirvandan gələn və o vilayətin mədaxilindən, məxaricindən tam xəbərdar və agah olan Qorçubaşı Padarın müşayiəti ilə Şirvanın fəthinə yollansınlar. Əmirlər əmrə uyğun olaraq, yola üz tutdular və gəmiləri cəmləşdirib Kür çayından keçdilər.

Nəzm

“Şirvan əhlinin başı yuxuya qarışmışdı,
Onlar bilmədilər ki, bir atəş dəryası sudan keçmişdir”.

Gəldi-gələn[2159] [qalasının] yaxınlığında yerləşən Sürxab qalasının ətrafı dəniz kimi coşan və ildırım kimi gurlayan ordunun dayanacaq məkanına çevrildikdə qala adamları müxaliflik etməyə başladılar. Əsgərlər bir həmlədə o qalanı tutdular və qalanın içindəkiləri əsir edib onların xanimanını soyğun və tarac süpürgəsi ilə süpürdülər. Əmirlər Qəbələ qalasına bir dəstə [qoşun] göndərdilər. Qazilər [həmin] qalanı [da] ələ keçirdilər və o qalada olan üç yüz nəfəri tutub əmirlərin yanına gətirdilər. Həmin vaxt ali məqamlı əmirlər Şirvan qalalarının ən möhkəmi olan Gülüstan qalasının fəthinə səy kəməndini atdılar. O diyarın hakimi Nemətulla bəy qalaya sığındı. Şahın əmirləri Gülüstan qalasının ətrafında çadırlarının və alaçıqlarının qübbəsini hündür edib təxminən otuz gün[2160] orada qərar tutdular. [Daha sonra] onlar qala ətrafında bir dəstə qoyub Biqurd qalasına üz tutdular. Şirvan padşahı Şahrux qazilərin gəlişindən agah olduqda vəkili Hüseyn bəyi igidlik əlamətli bir qoşunla müharibə meydanına göndərdi və o iki şövkətli güruh Biqurd dərəsinin ortasında bir-birinə yetişdilər.

Nəzm

“Şirvanlılar çatdılar dəstə-dəstə,
Onların dalğalanmasından çöl təlatümə gəldi.
O güruh elə dəbdəbə və əzəmətlə yetişdi ki,
Elburz dağı qüssədən dağılıb töküldü”.

Ox atmağa və qılınc çalmağa əl atdılar. Müharibə dəyirmanı fırlanmağa başladı, o dərədə qan arxı axdı. Hüseyn bəy öz alnında (taleyində) acizlik və sınıqlıq əlamətlərini müşahidə edib, qaçmağı üstün tutaraq qalaya getdi və qalanın [müdafiəsinin] möhkəmləndirilməsinə qərar verdi. Ora elə bir qala idi ki, son dərəcə hündür və istehkamlı idi və mavi rəngli asiman kimi əyyamın bəlalarından qorunmuşdu. Dərin xəndəyi əməl meydanı kimi olduqca enli, xəndək ətrafındakı hündür torpağı müdriklərin düşüncələri kimi son dərəcə yüksək idi.

Nəzm

“Onun bürcü iddia ilə ağzını açdı,
Ərşə bənzər küngürəsi söz dedi.
Binası asimanın tuğu idi,
Divarının iki pəncərəsi ay və gün idi.
Darvazasının fələk qübbəli tavanının,
Uca ərşə getmişdi avazəsi.
Başından bir daş bərk düşsəydi,
Asiman ondan laxta-laxta olardı”.

Aləmi işıqlandıran günəşdən başqa heç bir əcnəbinin narahatçılıq əli o qalanı və diyarı istila edə bilməmişdi. IV Xosrovdan[2161] başqa heç kimsənin fəth bayrağının quşu orada qol-qanad açmamışdı. Qızılbaş qoşunları Biqurd qalasının böyründə yerləşən Gürci qalasını istla etdilər və şirvanlılar dilavərlərin xofundan [Biqurd] darvazasını bağlamağı unutdular. Qazilər istədilər ki, qalanın içinə girsinlər. Bədir xan onlara mane olub dedi ki, əgər zəfər şüarlı qoşunlar qalaya daxil olsalar, onların mallarını talan edəcəklər. Şirvanlılar fürsəti qənimət bilib darvazaları bağladılar və müzəffər orduya qarşı müqavimət, vuruşma və müdafiə məqamında sabitqədəm oldular. Qızılbaş qoşununun mübarizləri qalanın ətrafını və yan-yörəsini əhatəyə alıb döyüşə başladılar. İçəridən və bayırdan ox və tüfəng [atəşləri] yağış qətrələri kimi aşağı enməyə və mömin

[2159] Məclis nüsxəsində yazılmış variantı əsas almışıq. Baroda nəşri və Bakı nüsxəsi: “Kilidi-Gilan”.
[2160] Məclis nüsxəsi: “bir ay”; Bakı nüsxəsi: “20 gün”.
[2161] Tarixdə IV Xosrov adlı hökmdar olmamışdır. Heç vaxt olmayan bir hökmdarın adını çəkməklə müəllif demək istəyir ki, bu qala heç vaxt fəth edilməmişdir.

adamların duaları kimi yuxarı qalxmağa başladılar. Həmin günlərdə bəd aqibətli Şahrux ilə bir dəstə bədbəxt cahillər şirin candan əl çəkib fədakarlıqla səy göstərirdilər və qılınc tiyəsinin camından ölüm qurtumu içirdilər. Bu minvalla dörd ay ərzində yüksək məqamlı əmirlərlə o azğın tayfa arasında savaş və hərb atəşi alışdı. Günbəgün döyüşdə o camaatın cidd-cəhdi yüksəlirdi və saatbasaat inadkarlıq və üsyan əlamətləri daha çox müşahidə olunurdu. Axırda zəfərə yoldaş olan qoşun o möhkəm qalanın bürclərini top zərbəsi ilə uçurdu.

Nəzm

"O döyüş meydanında ildırım kimi mərmidən,
Hasarda lalələr kimi deşiklər açıldı".

O əsnada Şəki hakimi Dərviş Məhəmməd xan dağ qoşununu toplayıb Şahruxun imdadına [yetmək üçün] qala ətrafına gəldi ki, əmirlərin düşərgəsinə gücə basqını etsin. O, həmin iddia ilə ordunun ətrafına gəlib nağara vurdurdu və şeypur çaldırdı. Məhəmməd bəy Şirbəxt oğlu Talış və qorçulardan bəziləri o azğınları dəf etməyə yönəldilər və onları məğlub edib [Dərviş Məhəmməd xanın] əksər adamlarını həyat paltarından üryan etdilər. Dərviş Məhəmməd xanın yardımından ümid kəsən şirvanlılar bu üzrxahlığı izhar etmək üçün dil açıb [dedilər] ki, dinin pənahı olan şah nəfis vücudu ilə buraya gələrsə, qalanı təslim edərik. Əmirlər Şirvan padşahının sözü haqqında ərizə hazırlayıb ali taxtın ətəyinə göndərdilər. Qasid Mərənddə səadətli padşahın ordusuna çatdı və şirvanlılar hər nə demişdilərsə, ərz etdi. Bu səbəbdən ulduzlar kimi həşəmətli padşah Şirvana yollandı və qala ətrafına gəldi. Biqurd dərəsinin tamamı alaçıqlar, bayraqlar, tövlələr, ordu və bargah çadırı ilə doldu.

Nəzm

"Ordu əhlinin cövşənlərinin çoxluğundan,
Saray pərdələrindən, alaçıq və bargahdan,
Yer elə oldu ki, yaxından və uzaqdan,
Yolu bağlandı səba və dəbur[2162] küləklərinin".

Şirvanlılara məlum oldu ki, dinin pənahı olan şah nəfis vücudu ilə qala ətrafına çatmışdır. Onlar o həzrətin tanıdığı bir şəxsi elçi sifəti ilə göndərdilər ki, doğru-düzgün xəbər gətirsin. O şəxs ərşə bənzər bargaha gəlib şirvanlıların sözlərini birbaşa surətdə [şahın] ərzinə yetirdi, nəvaziş görüb geri qayıtdı və nəyi ki görüb eşitmişdi, onlara xəbər verdi. Ertəsi gün Şahrux, Hüseyn bəy, Məhəmməd bəy və qalanın əyan-əşrəfi çoxlu töhfələrlə və hədiyyələrlə asiman dərəcəli astanaya gəldilər, bəndəlik izhar etdilər və baş əydilər.

Nəzm

"Kama yetmiş şahın lütfünün ümidi ilə,
Aman istəyən kəs qaladan bayıra çıxdı.
O ulu bargaha daxil oldu,
Təvazökarlıq edərək böyük tacdar.
Mötəbər xətdəki yanlışlıq kimi,
Onun qızıl üzərinə həkk olmuş sikkəsi eyibli oldu.
Padşahlığı etibarsız oldu,
Qocalmış gözəllərin misalında olduğu kimi".

Xəzinələrin, qapıların və dəfinələrin açarlarını ali divanın naiblərinə [təhvil] verdilər. Şahrux, Hüseyn bəy və Məhəmməd bəy dustaq edildi. İtaət edilməsi vacib olan fərman verildi ki, o qalanı xarab etsinlər.

Nəzm

"Qala təməldən yıxıldı sərbəsər,
Fələk bürcü kimi alt-üstü oldu.
Onun fəzasına uzaqdan zərər çatdı,
Binası alçaq oldu, xəndəyi hündür oldu.
Küngürəsi puçluqdan aşağı töküldü tamam,
Mişarlanıb torpaq yığınına çevrildi".

---

[2162] Dəbur – qərb küləyi.

Cümə günü, cəmadiyüləvvəl [ayının] 3-də (27.09.1538) Gülüstan qalasının kutvalı Nemətulla bəy aşağıya enib qalanı təslim etdi. Cəmadiyüləvvəl [ayının] 18-də (12.10.1538) Şirvan ordusundan Hüseyn bəy qətlə yetirildi və Şahruxu həbs edib özləri ilə Təbrizə gətirdilər[2163].

Elə ki Şirvan məmləkəti Tanrının köməyi ilə ələ keçirildi, bəlağət şüarlı münşilər həmin zaman aləm sakinlərinin hökmdarından zühura gəlmiş böyük işlərin surətini gövhər yağdıran qələmin ucu ilə vərəq səhifələrinə yazıb Azərbaycan, İraq, Fars, Kirman, Xorasan, Xuzistan vilayətlərinə və Ümman dənizi[2164] sahillərinə göndərdilər.

Dinin pənahı olan şah qılınc suyu ilə Şirvan qoşunlarının üsyan tozanağını yatırdı və onların tüğyanının şərini iti qılıncının nazil olması ilə məhv etdi. Hansı yerdə ki dikbaşlıq vardı, yox olub getdi.

Nəzm

“Harada ki qovğadan tozanaq gördü,
İti qılıncın gücü ilə onu yatırdı.
Zireh deşən oxların yağışı səbəbindən,
Üsyançılıq tozundan bir əlamət qalmadı”.

O diyarın idarəçiliyi Əlqas mirzəyə verildi. Qələbə ayətli bayraqlar səltənət taxtının məkanına yollandılar. [Dünyanın insanla] məskunlaşmış ¼ hissəsinin padşahının [qədəmindən qalxan] tozdan Təbriz əhalisinin ümid gözünə sürmə gəldi. Həmin diyar o həzrətin gəlişinin parlaqlığından İram bağının və cənnət bağçasının tayına çevrildi. Şairlərdən biri hər misrasından Şirvanın fəthinin tarixi peyda olan bir qəsidə deyib və bu iki beyt oradandır:

Nəzm

“Fələk ucalığında oturanların qaydası ilə bir-birinin ardınca,
Dəstə-dəstə gəldilər və nallar səfində səf qurdular.
Belə bir əsgərlə və bu qoşunla haraya üz tutsun ki,
Tale onu qarşılamağa çıxmasın?”

## Xarəzm vilayətində baş vermiş hadisələr haqqında söhbət. Din Məhəmməd xan Özbəyin Übeyd xanın əmirləri ilə müharibə etməsi

Bu il Xarəzm sultanları Sultan Ömər Qazini qətlə yetirdilər və o diyarda hərc-mərclik yarandı. Hər başda səltənət havası peyda oldu və hər rifahsız guşədən bir əl zülm qolçağından çıxdı. Hər gəda bir padşaha, hər əsir bir əmirə, hər gizir bir vəzirə və hər xəsis bir rəisə çevrildi.

Nəzm

“Toxum sünbüldən başını çıxardığı kimi,
Baş qaldırdılar o guşələrdən baş qaldırmışlar.
Hind mənşəli alçaq yoxsullar,
Əyləşdilər Samın[2165] və Qubadın[2166] yerinə.
Kəyanlıq[2167] çətirinə xələl toxundu,
Süleyman üzüyü bir şil-şikəstin barmağına keçdi”.

Rəiyyətin əhvalına çeşidli fəlakətlər yol tapdı. Sufiyan xanın övladları – Yusif sultan, Əli sultan, Ələş sultan[2168], Pəhləvanqulu sultan və Əqəş sultan Xarəzm vilayətini istila etdilər. Sultan Qazinin oğlu Ömər Qazi, Büraq xanın bacısı oğlu idi. O, fərar edib Daşkəndə getdi və Büraq xandan kömək dilədi. Büraq xan Übeyd xanla ittifaqda Mavəraünnəhr qoşunları ilə hiddətlə Xarəzmə gəldi. Yusif xanın ürəyinə çoxlu qorxu yol tapdı və o, Xorasan tərəfə qaçdı. Übeyd xan əğyarın məşəqqəti olmadan Xarəzmin məmləkət gəlinini ələ keçirdi. Yusif sultan getdiyi yerə çatdı, [orada] qardaşları böyük qoşunla ona qoşuldular və birlikdə

[2163] Məclis nüsxəsi: “Şahruxu həbs edib Bəhram mirzəyə tapşırdılar və Təbrizə apardılar”.
[2164] Burada İran körfəzi və Hind okeanı nəzərdə tutulur.
[2165] Sam – Firdovsi “Şahnamə”sinə görə, məşhur pəhləvan Rüstəm Zalın babasıdır.
[2166] Qubad – yəqin ki, Sasani şahı I Qubad (488-531) nəzərdə tutulur
[2167] Kəyan – Firdovsinin “Şahnamə” poemasında qədim İranda ilk sülalə olan Pişdadilərdən sonra hakimiyyət sürdüyü bildirilən əfsanəvi bir sülalə.
[2168] Məclis nüsxəsi: “Daiş sultan”. Baroda nəşri: “Üveys sultan”; Bakı nüsxəsi: “Əliş sultan”.

Ürgəncə yollandılar. Amudərya çayı kənarında Übeyd xanın və Büraq xanın əmirləri onlarla qarşılaşdılar və onlar arasında gərgin bir müharibə baş verdi. Mavəraünnəhr əmirləri fərar etdilər. Bu igidlik qarşısında rəqibin ayağı yerdən üzülsə də, onlar silahlarını savaşa hazır etməkdən əl çəkmədilər. Übeyd xan öz oğlu Əbdüləziz sultanı Ürgəncdə qoyub Büraq xanla və Əbdüllətif sultanla birgə Mavəraünnəhrə yola düşdü.

Eyni zamanda, dinin pənahı olan şah tərəfindən Nisa və Əbivərddə hakim olan Din Məhəmməd ibn Əluş xan[2169], Yusif sultanın köməyinə gələrək özbəklərə tac[2170] geyindirdi və xəbər yaydı ki, qızılbaş qoşunu [gəlib] çatmışdır. Onlar birləşərək [Ürgənc] şəhərini mühasirəyə aldılar. Əbdüləziz sultan bu xəbəri bildirmək üçün Übeyd xanın yanına qasid göndərdi və yardım istədi. Übeyd xan Amudərya çayından keçdi. Xarəzm sultanları Ürgəncin üstündən qalxdılar və pərən-pərən oldular. Übeyd xan Vəzir şəhərinə[2171] gəlib oranı ələ keçirdi və o şəhərin idarəçiliyini öz əmirlərindən birinə tapşırıb Buxara tərəfə geri qayıtdı. Həzarəsbə[2172] çatdıqda eşitdi ki, Din Məhəmməd sultan Xivəq qəsəbəsinə basqın edib və üsyan bayrağını qaldırıb. Onun qəzəb atəşi şölələndi və böyük əmirlərdən olan Dərviş bəyi qoşunun və gərənayların əksəriyyəti ilə Xivəq səmtinə göndərdi.

Bu tərəfdən Din Məhəmməd sultan yaka türkmənləri və Əli-eli[2173] camaatı ilə ittifaqda düşmən üzərinə hərəkətə gəldi. Həzarəsbin dörd fərsəxliyində, əl içi kimi hamar olan və ortasında nəhr olan bir yerdə iki firqənin yaxınlaşması qarşılaşma ilə nəticələndi. Din Məhəmmədin ordusunun mənqəlayı olan Yusif sultan vuruşmadan xəbərsiz olan Qaraca Bahadıra həmlə etdi, onu çox adamla birgə əsir tutdu, [digər] bir dəstəni isə təqib edib nəhrin sonuna yönəldi. Übeyd xanın əmirləri körpünün üstünü tutub ox yağdırdılar və gərənay çaldılar. Onlar öz imkan xurcunlarında olan bütün oxları Din Məhəmmədin qoşununa atdılar.

Nəzm

“Hər iki tərəfdən ox atışı oldu,
Dağ keçidi və çöl şikar qurbanları və ov heyvanları ilə doldu.
Oxla kamanın rəftarı ucbatından,
Mələk yeri, adam asimanı görmürdü.
O dava-qırğında sinə sandığından,
Kamandar oldu sənduqə düzəldən”.

Yaka türkmənlərini müqayisəyəgəlməz qorxu bürüdü və onlar Din Məhəmmədin bayrağını götürüb fərar etdilər. Əqəş sultan[2174] at çapıb onları qılınc zərbəsi ilə geri qaytardı. Eyni zamanda, qaçanların arxasından getmiş Yusif sultan döyüşə girdi və Übeyd xanın əmirlərinin üzərinə birdən hücuma keçdi. Düşmənlərin iqbal günəşi zavala uğradı və onlar idbar üzlərini fərar vadisinə tutdular. Übeyd xanın böyük əmirlərindən Lətif Mirək, Şeyx Nəzər bəy, Taci Bahadır Təvaçıbaşı, Qaraca Bahadır Vəkil və Hafiz Qünqürat əsir oldular. Dərviş bəylə Köpək bəy aradan çıxdılar. Həzarəsbdə bu xəbəri eşidən Übeyd xan bir dəvəyə minib Buxara tərəfə qaçdı.

Belə bir qələbə müzəffər padşahın dövlətinin sayəsində Din Məhəmmədə müyəssər olduğundan, o, bu xəbəri dinin pənahı olan şaha göndərdi. Onun qasidi Təbrizdə aləmin pənahı olan şahın sarayına gəldi və əhvalatın şərhini bəyan etdi. O həzrət həddən ziyadə sevindi, Din Məhəmməd xan üçün dəyərli xələtlər göndərdi və hər il Səbzəvardan alınan üç yüz Təbriz tüməninin pərvanəçəsini (fərmanını) ona bağışladı.

---

[2169] Məclis nüsxəsində səhvən “Din Məhəmməd və Üləş xan” yazılmışdır. Bakı nüsxəsi: “Din Məhəmməd ibn Üləş xan”. Müxtəlif qaynaqlarda “Əluş xan”, “Üləş xan”, “Uluş xan” və s. kimi yazılan bu şəxs adını türkcə “Ulaş xan”, “Oluş xan” və “Ulus xan” kimi oxumaq və mənalandırmaq mümkündür. Bu şəxs Din Məhəmməd xanın atasıdır.

[2170] Qızılbaş tacı nəzərdə tutulur.

[2171] Vəzir şəhəri – Türkmənistanın şimalında, Dəryalıq çayı sahilində orta əsr şəhəri. Hal-hazırda onun yerində Div-kəsən qəsəbəsi mövcuddur *(О.Экаев. Туpменистан и туркмены, c.14).*

[2172] Həzarəsb (farsca “min at” deməkdir) – Xivədən bir mənzil şərqdə *(Seddon, şərhlər, s.269).*

[2173] Əli-eli – Əndixud yaxınlığında yaşayan türk tayfası. Onlar Səfəvilərin süqutuna qədər bu sülaləyə vergi ödəmişlər *(Seddon, şərhlər, s.269).*

[2174] Bakı nüsxəsi: “Abış sultan”.

## 946-CI İLDƏ (19.05.1539 – 07.05.1540) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Şahqulu xəlifə Möhürdarı Astara tərəfə göndərməsi

Astara hakimi Əmirə Qubad dəfələrlə itaətsizlik əlamətləri nümayiş etdirdiyindən, dinin pənahı olan şah Şahqulu xəlifə Möhürdarı xeyli qazilərdən ibarət bir dəstə ilə o diyara yolladı. Əmirə Qubad qazilərin gəlişindən xəbər tutduqda öz tabeçilərini cəngəllikdə pərakəndə etdi. Şahqulu xəlifədən öncə Süleyman bəy Topçubaşı Ərdəbil mütəvəllisi Mir Əşrəflə[2175] ittifaqda əmirlərin mülazimlərindən bəziləri ilə Ərcüvana gəldi. O əsnada Əmirə Qubad hamısı divə bənzər çoxlu süvarilər və piyadalarla qarşıdurma və vuruşma məqsədi ilə qədəmini irəli qoyub döyüşə başladı. Qazilər bir həmlədə onları məğlub etdilər. O gün Süleyman bəy Topçubaşı elə döyüşdü ki, İsfəndiyarın və Rüstəmin ruhu ona afərin oxudu. Əmirə Qubad qaçmağı qənimət bilib özünü cəngəlliyə saldı. Qazilər onları təqib edib o bədbəxt güruhdan səkkiz yüz[2176] nəfəri qətlə yetirdilər və başlarını bədənlərindən ayırıb hökmdarın dərgahına göndərdilər. Dinin pənahı olan şahın fərmanı ilə o diyarın idarəçiliyi Bayandur xanda qərar tutdu.

### Dinin pənahı olan şahın Bəhram mirzəni Kürdüstana basqına göndərməsi

Bu il Bəhram mirzə və Gögçə sultan Qacar Kürdüstan vilayətinə basqına getdilər. O diyarın hakimi Sultan Əli Müsəlləh[2177] fərar etdi. Qazilər onun vilyətini çapıb taladılar, çoxlu mallar ələ keçirdilər və Təbriz tərəfə geri döndülər. Bu yürüşdə bəzi adamlar bir az süstlük göstərdilər. Onları eşşəklərə oturdub ibrət üçün bazarda gəzdirdilər.

### Müxtəlif əhvalatlar

Bu il Şüştər hakimi Mehdiqulu sultan Əfşarı qürur divi yoldan çıxardı. O, baş qaldırmaq və dikbaşlıq etmək iddiası nümayiş etdirib Şüştər qalasını zəbt etdi və təcavüz əlini bəndələrə əziyyət vermək və vilayəti xaraba qoymaq üçün uzatdı. Heydərqulu sultan Əfşara o zalımın dəf edilməsi göstərişi verildi və o, həmin şəhəri mühasirə etdi. Neçə gündən sonra, yekşənbə günü, zilhiccə ayının 21-də (28.04.1540)[2178] Mehdiqulu sultanın qardaşı Sevindik Bahadır onu (Mehdiqulunu) öldürüb başını aləmin pənahı olan dərgaha göndərdi.

Həmçinin bu il Təbrizdə taun [xəstəliyi] baş verdi. Dinin pənahı olan şah şəhərdən çıxdı və taun aradan qalxdıqda Təbrizə qayıtdı. Hər şeyi bilən Allahdır.

### Übeyd xan Özbəyin vəfatı

Übeyd xan ibn Mahmud sultan ibn *Budaq sultan* ibn Əbülxeyr xan ibn Dövlətşeyx-oğlan ibn İlti-oğlan ibn Fulad-oğlan ibn Eybə Xoca ibn Toğtay ibn Bolğan[2179] ibn Şeyban ibn Cuci ibn Çingiz xan[2180].

Übeyd xan xaricilikdə[2181] ad çıxarmışdı, mərhəmətinin yoxluğu ilə məşhur idi və qəlbinin sərtliyi ilə tanınmışdı. Elmlərdən xəbərdar idi və şairlikdə bənzərsiz idi. Şeybək xan zamanında Buxara hakimi idi. Sultan Hüseyn mirzənin (Bayqaranın) əksər övladlarını o məğlub etmişdir[2182].

---

[2175] Məclis nüsxəsi: "Mir Şərəflə".
[2176] Məclis nüsxəsi: "yeddi yüz".
[2177] Bu şəxsin adındakı Müsəlləh kəlməsi digər variantlarda (Tehran nəşində: "Bətənəliç"; Nuruosmaniyyə nüsxəsində: "Tənbəliç"; Məclis nüsxəsində: "Sultan Məsləc"; Bakı nüsxəsində: "Tələnc") yanlış və anlaşılmaz formada qeyd edildiyi üçün Baroda nəşrindəki yazı şəkli əsas alınmışdır .
[2178] 28.04.1540 – bazar (yekşənbə) gününə deyil, çərşənbə gününə təsadüf edir.
[2179] Bakı nüsxəsi: "Bolğay" (173b).
[2180] Übeyd xanın atası Mahmud sultan, Şeybani xanın qardaşı idi. Onların Əbülxeyr xandan Çingiz xana qədər gedib çatan nəsil şəcərəsi digər qaynaqlarda bu şəkildə əksini tapmışdır: Əbülxeyr xan ibn Dövlətşeyx-oğlan ibn İbrahim-oğlan ibn Fulad-oğlan ibn Məngu Teymur ibn Badakul ibn Cucibuğa ibn Bahadır ibn Şeyban xan ibn Cuci xan ibn Çingiz xan (bax: *N.Fəlsəfi. Zindeganiyi-Şah Abbasi-Əvvəl. I c. Tehran, 1334, s.156-157*).
[2181] Xarici – bəzi dairələrdə təəssübkeş sünnilərə verilən həqarətli ləqəbdir.
[2182] Məclis nüsxəsi: "Sultan Hüseyn mirzənin övladlarını o öldürmüş və həmin xanədanı yıxmışdı".

Bu il yenə də Xorasana yürüş etməyə və müsəlmanların mallarını tarac etməyə ürəyi mail oldu. Bu əsnada şiddətli intiqam alan, həm say-seçmə, həm də sadə camaata (hamıya) rahatlıq bəxş edən [Allah] onun səhhətinə qorxunc bir xəstəlik mübtəla etdi və o, böyrünü taqətsizlik yatağına qoydu. Ruh valisinin narahatçılıq əli onun bədən şəhristanından üzüldü və fitnə şihnəsi (Übeyd xan) yer üzündən köçüb yer altında məskən saldı. Onun hücum səmumu ucbatından otdan və sudan məhrum qalmış Xorasan vilayətinin səthi bu mərhəmətin buludlarının feyzindən yaşıllığa və seyrangahlığa qovuşdu. Öz zəfər atını yan-yörədə cövlana gətirən zərər meydanının süvarisi hərəkət yüyənini yoxluq diyarına tərəf [çevirib] çapdı.

Übeyd xan yeddi döyüş etmişdir: birincisi – Sultan Hüseyn mirzənin oğlu Köpək mirzə ilə müqəddəs Məşhəddə; ikincisi – İbnihüseyn mirzə ilə Səbzəvar ətrafında; üçüncüsü – Babur padşahla Buxara ətrafında; dördüncüsü – Əmir Nəcmlə və Babur padşahla Buxara ətrafında; beşincisi – Əxi sultanla və Dəmri sultanla Bistamda; altıncısı – dinin pənahı olan şahla Camda; yeddincisi – Sufiyan xəlifə Rumlu ilə Nişapur Əbdülabadında. Cam döyüşündən savayı, [digər döyüşlərdə] məğlub olmamışdır.

Bu hadisənin baş verməsindən sonra o səadətsizin əmirləri və dövlət ərkanı onun oğlu Əbdüləziz sultanı taxtda əyləşdirdilər və digər oğlu Əbdürrərim[2183] [ona] tabe oldu. [Übeyd xanın] ömrünün müddəti əlli üç il və səltənət əyyamı otuz il olmuşdur. Məmləkəti Buxara və Şəhri-Keş idi. Bütün Məvaraünnəhrdə sikkə onun adına idi. Onun vəfatından sonra sikkəni Kuçum xanın oğlu Əbdüllətif xanın adına vurdular.

### Ölümlər

Şahrux ibn Sultan Fərrux ibn Şeyxşah ibn Fərrux Yəsar ibn Əmir Xəlilulla ibn Sultan İbrahim ibn Sultan Məhəmməd ibn Keyqubad, Ənuşirəvan Adilin nəslindən idi. Bu il o, dinin pənahı olan şahın hökmü ilə qətlə yetirildi. Onun qətli ilə Şirvan sultanlarının dövləti süqut etdi.

Həmçinin bu il Qəzvin və Savucbulaq valisi Əmir sultan Rumlu Təbrizdə vəfat etdi. [Əmir sultanın ölümündən sonra] onun nəvəsi və bu sətirlərin müəllifi olan dəyərsiz zərrə (Həsən bəy Rumlu) qorçuluq möhnətinə giriftar oldu. Onun (Əmir sultanın) qoşununu isə öz tay-tuşları ilə müqayisədə müstəsna dərəcədə axmaq olan Pirsultan xəlifəyə verdilər.

Mövlana Rüknəddin Məsud Kaşi – onun doğum yeri Şirazdır. Amma Kaşanda daha çox qaldığı üçün Kaşi kimi şöhrət tapmışdır. O, birbaşa olaraq Mövlana Sədrəddin Əli Təbibin şagirdlərindəndir. Doğrudan da, tibb elmi üzrə məharətdə Calinus[2184], bəlkə, təcrübə çoxluğuna görə Betlimiyus (Betlimus)[2185] idi. Ömrünün axırında dinin pənahı olan şahın təbibi olmuşdu. Bu il o, dünyadan köçdü.

### 947-Cİ İLDƏ (08.05.1540 – 26.04.1541) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il dinin pənahı olan şah Surluq yaylağına təşrif gətirdi. Həmin məqamda Qazi xan Təkəlü beş min süvari ilə xondgardan üz çevirib səltənət taxtının ətəyinə yetişdi və Şirvan mahallarından olan Salyan və Mahmudabad ölkəsi tiyul kimi ona verildi.

O əsnada ali [hökmdarın] qulağına çatdı ki, Hacı Şeyx Kürd yolkəsənlərdən ibarət çoxsaylı bir dəstə toplayıb, baş qaldırmaq iddiasına düşmüşdür. Abdulla xan Ustaclu, Şahqulu xəlifə Möhürdar Zülqədər, Qazi xan Təkəlü və Qara Vəli Ərəbgirlü o bədbəxti dəf etməyə təyin olunub həmin tərəfə yollandılar. Hacı Şeyx Kürd qələbə nişanlı əsgərlərin xofundan dar yolları tutub müxaliflik bayrağını yüksəltdi. Müzəffər qoşunlar irəli gedib bahadırcasına səy göstərdilər.

Şeir

“Hər səmtdən səmum küləyi kimi yürüdülər,
Kürdlərin hamısı birdən hücum etdi.
Qızmış şirlər kimi o meydanda,
Özlərini ordunun mərkəzinə yetirdilər.
Havanın üzü qaraldı ordunun tozundan,

---

[2183] Tehran nəşrinndə “Əbdülkərim”, Baroda nəşri və Bakı nüsxəsində isə “Əbdürrəhim” yazılmışdır. Sonuncu variant daha doğrudur (bax: *Seddon, şərhlər, s.266*).

[2184] Antik yunan həkimi və filosofu Qalen.

[2185] Antik yunan alimi Ptolemey.

Günəşin və ayın gözü tutuldu”.

Döyüş əsnasında taleyin barmağından [çıxan] bir ox Mahmud bəy Xınısluya dəydi və onun həyatına son qoydu. Görkəmlərindən yaramazlıq yağan kürdlər xəncər zərbəsi ilə zəfər əlamətli qoşundan neçə nəfəri qətlə yetirdilər. Məkanın istehkamlı olması səbəbindən qazilər bir iş görə bilməyib [şah] ordusuna qayıtdılar.

**Dinin pənahı olan şahın Gürcüstan tərəfə qoşun çəkməsi, üsyançıları darmadağın və ram etməsi haqqında söhbət**

Bu il dinin pənahı olan şah islamın qələbəsi və Rəsulun (Məhəmməd peyğəmbərin) – ona salam olsun – dininin qüvvətlənməsi üçün imansız gürcüləri darmadağın və ram etmək məqsədi ilə şikar edə-edə Bərgüşata yollandı. Əmirlər, dövlət ərkanı və məmləkət sərdarları hər diyarın əsgərləri ilə zəfər şüarlı orduya qoşuldular. Ondan sonra kama yetmiş hökmdar bahadırların bir dəstəsi ilə Gürcüstana tərəf sürətlə yürüdü. Qaranlıq səbəbindən zəmanənin beyni qarışdığı bir gecədə,

Nəzm

“Elə bir gecədə ki, qara aqat kimi üzünü sanki qırla yumuşdu,
Nə Bəhram[2186] peyda idi, nə Keyvan, nə Tir”[2187],

islam qoşunu iblisin məkanı və mənzili olan Tiflis şəhərinə töküldü.

Nəzm

“Qiyamət şövkətli qənimət aparanlar,
Birləşib qarət ardınca getdilər.
Yolun hər sirrindən agah olsa da,
Gürcü ordusunun süvari qaravulları,
Hamısı başını sehr yuxusuna qoyub yatmışdı,
Qarətkarlar xəbərsiz keçib getdilər.
Sübh çağı bayraq yüksəltdilər,
Darvazalar üstünə xəbərsiz çapdılar.
Gürcü igidləri fəraq yuxusunda idilər ki,
Səhər küləyi öldürdü şamı və çırağı.
Birisi qapını sındırdı və bayıra əsir apardı,
.........................................................[2188]
Birisi öz dəstəsini sürüyə tərəf apardı,
Çobanı öldürdü və sürüsünü apardı”.

Bəla tufanı yüksəldi. Şəhərə soyğun və tarac atəşi vurdular və onların arvad-uşaqlarını əsir etdilər. Luarsabın mötəbər əmirlərindən olan Kəlbad (Gülbad?) Gürcü bir dəstə aznavurla Tiflis qalasına pənah apardı. Axırda o, aman istəyib qalanı təslim etdi və islam əhli silkinə daxil edildi. Zəfər şüarlı qazilər iti xəncər və atəş yağdıran qılınc zərbəsi ilə Gürcüstan vilayətinin ərazisini murdar gavurların vücudundan pak etdilər.

O əsnada Luarsabın mötəbər əmirlərindən olan Həbəş[2189] çoxlu [qızılbaş] qoşunlarının qorxusundan qaçaraq özünü Bertis[2190] qalasına saldı. Ora elə bir qala idi ki, orada oturanların əli fələyin Sünbüləsinə[2191] çatırdı və onun sakinlərinin qulağı mələyin zümzüməsini eşidirdi.

Şeir

“Fələyin mühiti o qalanın xəndəyidir,
Tanrıdan başqa heç kəsin oraya əli çatmaz.
O qalanın başında yanan məşəl,
Asimandakı parlaq ulduz kimidir”.

---

[2186] Baroda nəşri: “günəş”.
[2187] Bəhram – Mars; Keyvan – Saturn; Tir – Merkuri.
[2188] Bu misra nüsxələrin heç birində yoxdur.
[2189] Baroda nəşri: “Heyş” və ya “Hiş”.
[2190] Bertis (Birtvisi) – Tiflisdən cənub-qərbdə, Alget çayının solunda yerləşən möhkəm qala *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi, s.172).*
[2191] Sünbülə – astronomiya elminə görə, on iki bürcdən biridir.

Pərvərdigarın köməyi ilə zəfər şüarlı qoşunlar o qalanın ətrafında dairə kimi düzüldülər və oranı bir nöqtə kimi araya alıb döyüşə başladılar.

Nəzm

“Biri getdi xəndəyin ətrafındakı torpaq yığınına,
Elə cəld getdi ki, lap asimandakı günəş kimi.
O, digər əli ilə nərdivanını aparırdı irəli ki,
Torpaq bürcə öz ayağını qoysun.
Dağ və dəniz bir-biri ilə cəngə gəldi,
Cahan bu düşmənçilikdən təngə gəldi”.

Qələbə aqibətli qazilərin həmləsindən və hücumundan imansız gürcüləri tamam xof bürüdü [və onlar] qalanı təslim etdilər. Hər kim “Allah istədiyini düz yola yönəldər”[2192] təlqininə müvəffəq oldusa, aman tapdı. Hər kim “Biz nə bu “Quran”a, nə də ondan əvvəlkilərə inanırıq”[2193] məzmununa uyğun olaraq israr etdisə, varlıq xırmanını fanilik küləyinə verib, yoxluq yükünü axirətə çəkib apardı. Ondan sonra qalibiyyətli bayraqlar Gürcüstanın Didkur dağına[2194] tərəf hərəkətə gəldi. Doğrudan da, o şövkətli dağ dövr edən asimanın qülləsi ilə bərabərlik və bu mavi hasar qəsrinin (göy üzünün) qübbəsi ilə başa-başlıq iddiasına malik idi.

Nəzm

“Möhkəm və başı sərt bir dağdır,
Qiyamət günündən daha sərtdir o.
Əgər günəş və ay onun başına nəzər salsa,
Onların öz başlarından papaqları düşər.
Onun başından elə ki vəhşi heyvan suya gəlir,
Günəş çeşməsindən su içir.
Keçisinə fələk ürək oxşayan yaşıllıq,
Çəpişinə asiman süd veribdir.
Oranın qartalı mələk quşunu ovlayır,
Aşiyanı fələyin hündür yeridir.
Ulduz onun ətrafında, yan-yörəsində,
[Dağ] ətəyindəki lalə kimi parlayır.
O qayalıqda yırtıcılar özlərinə yer etmiş,
Ora adam qapan gavurların yurdudur”.

Fələk əlamətli ordu möhkəm yer və mətin mövqe olan o dağı zor və güc yolu ilə ələ keçirdi. Kafirlərin əxlaqsızlarından ibarət çoxsaylı bir dəstəni dağın dar keçidlərində və sığınacaqlarında qətlə yetirdilər və o məlunların sabit bünövrəsini atəş həmləsinin küləyi ilə lərzəyə gətirdilər. O ümidsizlərin qılıncdan qurtulanları pərakəndə çəyirtkələr kimi çölə qaçdılar. Ali məqamlı şah pis etiqadlı kafirlərə qarşı cihad niyyəti ilə Kür çayı kənarına getdi. O diyarın hakimi olan Luarsab Gürcü fərar edib, özünü möhkəm dağlara və ağacla dolu meşələrə salaraq qazilərin əlindən xilas oldu. O zaman zəfər mahiyyətli bayraqlar səadət və iqbal ilə geri qayıdıb cah-calalla Təbrizə təşrif gətirdilər.

### Əmirlərin Rüstəmdar üzərinə basqına getməsi

Bu il Pirsultan xəlifə Rumlu, Hüseyncan sultan Rumlu, Şahqulu sultan Ustaclu və Əhməd bəy Türkman bir dəstə bahadırla Rüstəmdara yollandılar. O vilayətin hakimi Məlik Cahangir ibn Kavus namussuz rüstəmdarlılarla birlikdə Larican qalasına pənah apardı. Qızılbaş əsgərləri hay-küylə qalaya həmlə etdilər. Əhməd bəy Türkman bir dəstə dilavərlə qala darvazasına gəldi və bədkirdar rüstəmdarlıları ov heyvanı kimi pərən-pərən etdi. Məlik Cahangir dünyanı tutan qoşunların qılınclarının qorxusundan aman dilədi. O əsnada ordu sərdarı Pirsultan xəlifə “ağlının və biliyinin” kamal dərəcəsində olması səbəbindən qala ətrafındakı bir

---

[2192] *Qurani-Kərim, “Bəqərə”, surəsi, 213-cü ayə.*
[2193] *Qurani-Kərim, “Səba” surəsi, 31-ci ayə.*
[2194] Gürcü mənbələrində bu dağın adı Kvataxevi deyə qeyd olunmuşdur *(Парсадан Горгиджанидзе. История Грузии, перевод с грузинского Р.К.Кикнадзе и В.С.Путуридзе. Тбилиси, 1990, s.30)*

bağa gəlib bir qaysı ağacına dırmanmışdı və [qaysı] yeməklə məşğul idi. Buna görə də Əhməd bəyin imdadına çatmadı. Pirsultan xəlifənin namərdliyini müşahidə edən rüstəmdarlılar Əhməd bəyin üstünə töküldülər. Onlar ox və zubin yarası ilə Əhməd bəyi bir dəstə mülazimlə birlikdə qətlə yetirdilər. Pirsultan xəlifə qorxaqlığının çoxluğu ucbatından [oradan] geri qayıtdı.

Nəzm

“Əgər ordu başçısı qorxaq olarsa,
Qoşunun işi sərasər puç olar.
Ordu rəhbəri heç vaxt cəsarətsiz olmasın,
[Cəsarətsiz] olarsa, qoşunun namusunu küləyə verər”.

### Müxtəlif əhvalatlar

Əmir Əbu-İshaqın oğlu Həsən sultandan dəfələrlə nifaq əlamətləri zahir olmuşdu. Buna görə də [şah tərəfindən] qarşısında aləmin müti olduğu bir fərman verildi ki, Qazi xan Zülqədər Fars [vilayətinin] qoşunları ilə o diyara yollansın və sözügedən şəxsi tutub aləmin pənahı olan dərgaha gətirsin. Fərmana uyğun olaraq, əmirlər Bəhram [kimi] qəhredici ordu ilə Rişəhrə[2195] yollandılar. Həsən sultan dilavərlərin xofundan qalaya pənah apardı. Qızılbaş qoşunu mühasirəyə başladı. Onlar [isə] canlarının qorxusundan müdafiə ilə məşğul oldular. Mühasirə əyyamı tamam uzandıqda, Əmir Seyid Şərif aman istəyərək onu qaladan çıxardı. Qazi xan onu Təbrizə göndərdi və o, dinin pənahı olan şahın əmri ilə öldürüldü.

Bu il dinin pənahı olan şah Səhənd yaylağına getdi. Orada Əlqas mirzə və Şəki hakimi [Dərviş] Məhəmməd xan aləmin pənahı olan dərgaha gəldilər.

Bu il Qazi xan Təkəlü Bakı qalasını tutub bir çoxlarını qətlə yetirdi. Dinin pənahı olan şahın qışlağı Təbrizdə baş tutdu.

### Ölümlər

Bu il Şiraz valisi Qazi xan Zülqədər axirət aləminə yollandı. Şiraz hakimliyi Keçəl bəy Zülqədərin oğlu İbrahim bəyə verildi və ona xan adı qoydular (xan rütbəsi verdilər).

İsmini daha öncə zikr etdiyimiz Əmir Abdulla Hüseyni Lalə sözügedən ilin ramazan ayında (30.12.1540 – 28.01.1541) vəfat etdi.

## 948-Cİ İLDƏ (27.04.1541 – 16.04.1542) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Dizfula getməsi

Bu il şahın məiyyəti səadət və uğurla Xuzistan vilayətinə tərəf hərəkət etdi. Bu yürüşün səbəbi o idi ki, Dizful valisi olan Əlaüddövlə Rənaşi[2196] başını itaət boyunduruğundan və boynunu tabeçilik çənbərindən çıxarmışdı. Ordu başçılarının və dərgah böyüklərinin toplanması haqqında hökmdar fərmanı verildi. Döyüşkən bahadırlar mükəmməl olduqdan sonra [şah] məqsədə doğru yola çıxdı.

Nəzm

“Yola düşdü uğurla cahan qoşunu,
Səadət ona kömək edirdi, zəfər ona yoldaş idi”.

Xürrəmabadın hüdudu dindar və ədalətli padşahın dayanacaq yeri olduqda Kiçik Lur [vilayətinin] hakimi Cahangir [özünü] sultanların pənahı olan dərgaha yetirdi. Dinin pənahı olan şah Dizfula irəlilədi. Əlaüddövlə Rənaşi küləyin tünd əsməyindən öncə qaçan ağcaqanad kimi, hətta ondan da betər bir şəkildə, kədərlə və könülsüzcəsinə qaçıb Bağdad tərəfə getdi.

Nəzm

“Həmin zaman o işrət məkanından getdi,
Qaçaraq Bağdad sərhədinə getdi”.

---

[2195] Rişəhr – bu adda iki şəhər vardır: biri Buşir yaxınlığında, digəri isə Behbehan yaxınlığındadır *(Seddon, şərhlər, s.271).*

[2196] Baroda nəşri: “Rənaşi” əvəzinə “İsmaili” yazılmışdır. Rənaş – Dizful yaxınlığında bir kənd idi (*Nəvai, şərhlər, s.1279).*

O diyarın rəiyyəti [Şah Təhmasibi] qarşılamağa tələsib qalanın açarlarını təslim etdilər. Dinin pənahı olan şah o vilayətin idarəçiliyini Heydərqulu sultan Əfşara tapşırdı. Orada Hüveyzə hakimi Seyid Səccad ibn Bədiran Müşəşəyi itaət və sədaqət kəmərini canının ortasına bağlayıb aləmin pənahı olan dərgaha tələsdi. Dinin pənahı olan şah Hüveyzə hakimliyini yenidən ona tapşırdı. O həzrət (Şah Təhmasib) İbrahim xan Zülqədəri və Hüseyncan sultan Rumlunu Bayat qalası[2197] vilayətinə basqına göndərdi. Əmirlər o diyara basqın edib sağlam şəkildə, qənimətlərlə birlikdə hökmdar ordusuna qayıtdılar.

Elə ki dinin pənahı olan şah Xuzistanın bütün işlərindən xatircəm oldu və hadisələrin oxundan xatirlərinə azar dəymiş rəiyyətləri şahanə mərhəmətlə əzizlədi, geri qayıtmaq arzusuna düşüb hərəkət yüyənini Qum şəhərinə tərəf döndərdi və həmin şəhərdə qışlaq etdi.

Bu sətirlərin müəllifi Həsən Rumlu dinin pənahı olan şahın Dizfula hərəkəti zamanından hicri tarixinin 980-ə (14.05.1572 – 03.05.1573) çatdığı indiki vaxta qədər bütün səfərlərdə fələk şövkətli ordu ilə birlikdə yol getmiş, əksər hadisələri öz gözü ilə müşahidə etmişdir.

### Müxtəlif əhvalatlar

Əmir Sədrəddin Məhəmməd, Əmir Nizaməddin Əhməd, Əmir Qəmərəddin Mahmud və Əmir Əbülməhamid[2198] Lütfulla – Hüseyni seyidlərindən idilər. Onların doğum yeri Təbriz nahiyələrindən olan Üskuyə[2199] kəndidir. Onların babası Əmir Əbülqasım[2200] yüksək şanlı seyidlərdən olub, maddi və mənəvi kamillikləri, dini və dünyəvi səadətləri özündə birləşdirmişdi. O, Həzrət Mir Seyid Əli Həmədaninin şərəfli sülaləsindən olan və Təbrizin Xosrovşah kəndində yaşayan Şeyx Yaqub Ruminin müridi olmuşdur. Sabiq sultanlar həmişə ona hörmət və ehtiram göstərmişlər. Amma adı çəkilən seyidlər uzun müddət dinin pənahı olan şahın xidmətində səltənət və xilafət işlərində iştirak etmiş, bu cəhətdən etimadlı adamlara çevrilmiş, mülk və millət məsələlərində tədbir sahibi olmuşdular. İş o yerə çatmışdı ki, dinin pənahı olan şahın xidmətində onların yaxınlığı və məhrəmiyyəti doğru olmuşdu, onlardan başqalarınınkı yalan olmuşdu.

Xülasə, qeyd aparan fələk katibinin qələmi nurlu günəşin zərnişan səhifələri üzərində yazmaq vadisinə qədəm qoyduğundan və müqəddəs ilahi əl dəyirmi asimanın laciverdi vərəqlərini ulduzların parlaq naxışları ilə bəzədiyindən bəri fərdlərdən heç bir fərdin məliklərin və sultanların xidmətində bu qədər yaxınlığa malik olduğu görülməmiş, xüsusən də qızılbaş təbəqəsi arasında və məhrəm olan xas hərəmxanada heç kim [şaha] bu qədər yaxın olan adam eşitməmişdi. Keyvan səviyyəli mövqelərinin və dərəcələrinin eyvanı "[Allah] elm bəxş edilmiş kimsələrin dərəcələrini ucaltsın"[2201] kitabəsi ilə bəzənmiş fəzilət və kamal yiyələri onların astanalarına fəxr və iftixarla baş qoymuşdular və əhval səhifələri "Onları yaratdığımız məxluqatın çoxundan xeyli üstün etdik"[2202] naxışları ilə süslənmiş olan cah-calal sahibləri onların itaət və tabeçilik yəhərini can çiyinləri üzərinə götürmüşdülər. Kama yetmiş hökmdar sonsuz və bol ənamların qapılarını onların üzünə açmış, onları geyim [əşyaları], minik [heyvanları] və s. bu qəbildən olan hədiyyələrin lütfü və ehsanı ilə təltif etmişdi. O həzrətin hüzurunda ərz etdikləri hər bir istək, müxtəlif çətinliklərə baxmayaraq, təxirə salınmadan və boyun qaçırılmadan həyata keçirilirdi. Əlahəzrət dəfələrlə qüdrətli dövlətin ərkanı ilə birlikdə Üskuyə tərəfə gedib [onlara] qonaq olmuşdu və onlara münasibətdə son dərəcə iltifat, kamal həddində mərhəmət, qayğıkeşlik və lütfkarlıq yerinə yetirmişdi. Onların könlünün rahatlığı üçün işrət məclisləri və sevinc dolu yığıncaqlar tərtib olunmuş, cürbəcür şən söhbətlər və xoşhallıqlar edilmişdi.

Amma onlar bu nemətin qədrini bilmədilər və bu bəxşişin əvəzində şükür etmədilər. Çünki onların arasında dünyanın yolundan və yordamından xəbərdar olan bir kimsə yox idi. Onlar divan işlərinə dair səriştəyə malik olmadıqları halda, özlərinə münasib olmayan işlərə baş qoşdular. O səbəbdən ali, müqəddəs və şərəfli [hömdarın] könlündə [onlara qarşı] küdurət meydana gəldi. Dövlət ərkanı söz [deməyin] yolunu tapıb, günlər ötdükcə müqəddəs və şərəfli [hökmdarın] könlünü onlardan döndərdi. Onların ucalmasının və onların

---

[2197] Bayat qalası – İranın Luristan vilayətində, Tib çayının mənbəyi yaxınlığında yerləşirdi *(F.Sümər. Oğuzlar. Bakı, 1992, s.227).*
[2198] İsgəndər bəy Münşiyə görə: Əbülhamid.
[2199] Üskuyə (Üskü) – Təbrizdən cənub-qərb tərəfdə yerləşən bir kənddir.
[2200] Məclis nüsxəsi: "Əmir Seyid Hüseyn Kuhi".
[2201] *Qurani-Kərim, "Mücadilə" surəsi, 11-ci ayə.*
[2202] *Qurani-Kərim, "İsra" surəsi, 70-ci ayə.*

mövqeyinin yüksəlməsinin vasitəçisi olmuş Qazı Cahan zamanın məsləhətinə və zərurətinə uyğun olaraq vərəqi çevirib, onlara [qarşı] nifaq məqamına gəldi. Onlar xəlvəti yerlərdə öz yaxınlarından ibarət bir dəstə adamla dövlət işləri barədə tədbir düşünürdülər, vəkalət, sədarət, vəzarət kimi vəzifələrin və dinin pənahı olan şahın işlərini yönləndirən digər vəzifələrin öz qohumlarına, dostlarına və yaxınlarına [verilməsini] məsləhət görürdülər.

Axırda qəzavü-qədər kimi cərəyan edən bir fərman verildi ki, onlar Üskuyə kəndində sakin olsunlar və bir də ulu dərgaha gəlməsinlər. [Lakin] əlahəzrət onların külli məbləğə malik olan soyurğallarını [onlara] bağışladı.

Bu ilin əvvəllərində özbək sultanlarının elçiləri – Bəlx hakimi Kəskən Qara sultan tərəfindən Cahan Çərə[2203] və Buxara hakimi Əbdüləziz sultan ibn Übeyd xan tərəfindən Xudaverdi bəy – bol peşkəşlərlə Təbrizdə dinin pənahı olan şahın dərgahına gəldilər və neçə gün sonra qayıtmağa rüxsət aldılar. Hacı Ağa Mehmandar onlarla birlikdə [şah tərəfindən] elçi kimi yola düşdü.

**Ölümlər**

Əmir Qiyasəddin Mənsur ibn Əmir Sədrəddin Məhəmməd Şirazi elmi və əməli hikməti özündə cəmləşdirməsi üzündən üçüncü müəllim ("salisi-müəllimin") idi[2204]. Onun əhvalının tale üfüqündən mənəvi fəzilət ulduzları doğmuş və onun əsərlərində əksini tapmış elmlərin məqsədlərindən nurlu kamal şəfəqləri parlamışdır.

Nəzm

"Namaz və oruc baisinin şərəfindən,
Sədarətin "sad"ına[2205] çevrilib o.
O, möminliyin dibaçəsini,
Gözəl kəlamlarla İrəm bağlarına bənzədib".

Onun şanının uca və biliyinin çox olmasını göstərmək üçün təkcə bunu qeyd etmək kafidir ki, İsgəndər şanlı xaqan öz səltənəti zamanında tədqiqatçı alimlərin alimi, araşdırmaçı fazillərin ən kamili, peyğəmbərlər ağasının (Məhəmməd peyğəmbərin) elmlərinin varisi, bəşərin ustadı, on birinci ağıl ("əqli-hadiəşər")[2206] Xoca Nəsirəddin Tusi həzrətlərinin Marağada yerləşən və tamamən viran olan rəsədxanasını təmir etmək üçün məhz onu tələb etmişdir (çağırmışdır). Lakin bu işin tamamlanması otuz ilə baş verəcək Zühəl dövrünə təsadüf etməli olduğu üçün İsgəndər şanlı xaqan zamanın uzunluğunu ərz edib bu işin tamamlanmasına səy göstərmədi.

Cənab Mir [Qiyasəddin Mənsur] atəşək xəstəliyindən[2207] çəkinərdi və o səbəbdən cəmi aləm əhlindən iyrənərdi, əlini insan fərdlərindən heç bir fərdin əlinə vurmazdı. Qorxardı ki, birdən həmin adamda atəşək olar. Əgər bəzən böyüklər və alilər onunla görüşmək istəsəydilər, əlini ətəyinə tutub görüşərdi. Əgər bir kəs onun tabeçilərindən birini onun etibar nəzərindən salmaq istəsəydi, sübutsuz-dəlilsiz həmin adamı adı çəkilən xəstəlik vasitəsilə [onun] nəzərindən salardı və [Əmir Qiyasəddin Mənsur] bu [iddianın] doğru olub-olmadığına diqqət yetirməzdi. O, sədarət [vəzifəsini tutduğu] zaman Qazı Əli Bağdadi onun divan işlərinin icraçısı idi. Bir gün Qazı Müsafir zarafat və məzə üzündən ərz etdi ki, Qazı Əli bundan öncə atəşək xəstəliyinə mübtəla olmuşdur. Növbəti gün Qazı Əli o həzrətin yanına gəldi ki, Mirin cibindən möhürü çıxarıb buyruqları və hökmləri möhürləsin. Mir, Qazıdan nifrət edərək özünü ondan uzaq saxladı. Hərçənd Qazı onun yanına getsə də, Mir özünü ondan aralı tutdu. Bu minvalla Mir ilə Qazı bütün divanxananı gəzdilər. Ondan sonra

[2203] Bakı nüsxəsi: "Cahan Çöhrə".

[2204] Salisi-müəllimin (üçüncü müəllim) – Şərq peripatetizm cərəyanına görə, "birinci müəllim" Arestotel, "ikinci müəllim" isə Fərabi idi. Onlardan sonra müxtəlif qaynaqlarda bir çox filosof-alimlər "üçüncü müəllim" tituluna layiq görülmüşlər. Bu titula sahib olan məşhur elm xadimlərindən biri də Nəsirəddin Tusi olmuşdur.

[2205] "Sad" – ərəb qrafikalı əlifbadakı hərflərdən birinin adı. Sədarət sözü "sad" hərfi başlayır. Bu beytdə sədarət mənsəbini daşıyan Əmir Qiyasəddin Mənsura bu vəzifənin çox yaraşdığına işarə edilmişdir.

[2206] Şərq peripatetizmi on ağıl növünün mövcudluğunu qəbul edirdi. N.Tusinin zəkasının böyüklüyünü göstərmək üçün onu "on birinci ağıl" adlandırırdılar.

[2207] Ə.Nəvai burada bəhs edilən atəşək xəstəliyinin siflis xəstəliyinə işarə olduğunu yazır *(Nəvai, şərhlər, s.1284).*Ç.N.Seddon da bu ifadəni ingilis dilinə "venereal disease""(zöhrəvi xəstəlik") şəklində tərcümə etmişdir *(Baroda nəşri, II c., s.137).*

Qazı bildi ki, [Mirin ona olan] nifrətinin səbəbi nədir. Bu [nifrəti] aradan qaldırmağa nə qədər səy göstərsə də, faydası olmadı. Bu səbəbdən onun (Qiyasəddin Mənsurun) haqqında demişlər:

Rübai

“O Mir vəsvəsədən libas geyib,
Atəşəkdən daima qorxusu və hürküsü var.
O, əlini vəsvəsədən nə qədər yusa da,
Vəsvəsə öz əlini onun ətəyindən çəkmədi”.

Zəmanə müctəhidi olan həzrət (Şeyx Əli ibn Əbdüləali) ikinci dəfə İraqri-Ərəbdən xilafət məqamlı taxtın ətəyinə gəldiyi zaman o həzrət (Əmir Qiyasəddin Mənsur) sədarət şərəfinə malik idi. Zəmanə müctəhidi Mirin müqəddəs şəriətin qeydinə qalmaması və onun bəzi fitnə-fəsad işlərə, yaramazlıqlara və cahilliklərə baş qoşması haqqında söhbətləri eşidib ona qarşı ədavət etməyə başladı. İki tərəf arasında elə güclü bir düşmənçilik yarandı ki, bunu heç bir şəkildə aradan qaldırmaq mümkün deyildi. Axırda bu məsələ tamamilə qəbahətli bir şəkil aldı. Bir gün zəmanə müctəhidi behişt ayinli məclisdə hazır idi ki, Mir təşrif gətirdi və elmi mübahisə ortaya çıxdı. O mübahisə kobudluq və münaqişə ilə nəticələndi. Dinin pənahı olan şah zəmanə müctəhidini himayə etdi və həmin məclisdə onu (Qiyasəddin Mənsuru) sədarətdən çıxardı. O, bir neçə gün dərgah mülazimi olduqdan sonra Şiraz tərəfə yola düşdü və bu il dünyadan köçdü.

Əsərləri sırasında bunlar vardır: “Haşiyeyi-hikmətül-eyn” (“Varlıq hikmətinin haşiyəsi”), “Haşiyeyi-zövra” (“Zövra[2208] haşiyəsi”), “Əxlaqi-Mənsuri” (“Mənsurun əxlaq kitabı”), “Mühakimat” (“Mühakimələr”), “Haşiyeyi-işarat” (“İşarələr haşiyəsi”), “İsbati-vacib” (“Vacib olanın isbatı”), “Məşariq” (“Məşriqlər”), “Haşiyeyi-təcrid” (“Təcrid haşiyəsi”), “Təfsiri-sureyi-həl-əta” (“Həl-əta surəsinin təfsiri”)[2209], “Miratül-həqaiq” (“Həqiqətlər aynası”), “Səğir dər heyət” (“Astronomiya haqqında kiçik kitab”), “Ləvameyi-heyət” (“Astronomiya şəfəqləri”), hesab haqqında “Kifayeyi-Mənsuri” (“Mənsurun yetərli əsəri”), “Riyazi-rizvan” (“Cənnət bağları”), kəlam elmi haqqında “İmanül-eyman” (“Əmin iman”) və “Dəlili-hüda” (“Doğru dəlil”).

Həmçinin bu il həbsdə olan Şah Qivaməddin Məhəmməd Nurbəxş fərar edib fitnəyə bais olmasın deyə, axırda Təbrizdən Əlincəq qalasına göndərildi və işgəncənin şiddətindən axirət aləminə köçdü.

## 949-CU İLDƏ (17.04.1542 – 05.04.1543) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT[2210]

### Dinin pənahı olan şahın Sərəbənd yaylağına getməsi və Din Məhəmməd Özbəyin Astarabada gəlməsi

Bahar fəslinin əvvəllərində Cəmşid iqtidarlı padşah Qum şəhərindən Sərəbənd yaylağı[2211] tərəfə gəldi. Səadətli hökmdar o məkanda neçə gün eyş-işrətlə keçirdi. Həmin zaman o həzrətin səhhəti korlandı, [lakin] daha sonra [onun] xoşbəxt xüsusiyyətlərə malik zatına tam şəfa nəsib oldu.

Həmin günlərdə dinin pənahı olan şaha [xəbər] çatdı ki, Mavəraünnəhr qoşunundan bir tayfa Amudərya çayını keçmək fikrinə düşübdür. Buna görə də Bəhram mirzə, Bədir xan Ustaclu, Hüseyncan sultan Rumlu, Budaq xan Qacar və həmin vaxt hökmdar ordusuna gəlmiş olan Məhəmməd xan Təkəlünün oğlu Qazaq bəy Lar yaylağına göndərildilər.

Bəhram mirzə öz vəziri Xoca İnayəti çoxsaylı bir dəstə ilə Rüstəmdara basqın etməyə göndərdi və Xoca İnayətulla şücaətli qazilərlə o diyara basqın edib salamatlıqla və qənimətlərlə birlikdə orduya döndü[2212].

---

[2208] Zövra (Zura) – Dəclə çayını və Bağdad şəhərini bildirən termin.

[2209] “Həl-əta” (ərəbcə) – hərfi mənası “gəldimi?” deməkdir. Bu ifadə öz mənşəyini “Qurani-Kərim”in 76-cı surəsinin 1-ci ayəsindən götürmüşdür. Bəzi təfsirçilərin əqidəsinə görə, bu ayə Həzrət Əlinin şərəfinə nazil olmuşdur *(M.Müin. Fərhəngi-farsi, IV c., s.311).*

[2210] Baroda nəşri və Bakı nüsxəsində (180a) 950-ci il hadisələri buradan başlayır.

[2211] Sərəbənd yaylağı – Həmədan yaxınlığındadır *(Seddon, şərhlər, s.272).*

[2212] Bu abzas Məclis nüsxəsində aşağıdakı şəkildə verilmişdir: “Bəhram mirzə cənabları oraya getdikdə hamıdan Rüstəmdar camaatının müxalifliyini eşitdi və oranın əmirləri mirzənin hüzuruna gəlmədilər. O əsnada Mazandaran və Rüstəmdarın xəracını toplamaq üçün gəlmiş Əsəd bəy Mehmandar şikayət etdi ki, onlar vergini ödəməyə laqeyd yanaşırlar. Ona görə də kama çatmış mirzə cənabları məclisdə şah əmirlərinə dedi ki, bu camaatı cəzalandırsınlar. Adı çəkilən əmirlər vəziyyətə layiq olan bir cavab vermədilər. Bəhram mirzənin ürəyi daraldı və istədi ki, özünə aid qoşunla şəxsən [qiyamçıları cəzalandırmaq üçün] yola çıxsın. Elə bu əsnada mirzə cənablarının vəziri Xoca İnayətulla çoxsaylı bir dəstə ilə Rüstəmdara basqın etməyə gedərək o diyarı çalıb-çapdı və Əmir Ca-

O günlərdə dinin pənahı olan şah, Abdulla xanı və Şahqulu[2213] sultanı Kəlhur ulusuna basqın etməyə yolladı. Əmirlər həmin ulusu qarət edib fələk misallı dərgaha qayıtdılar.

Elə ki dinin pənahı olan şahın səhhətinin korlanması [xəbəri] Din Məhəmməd Özbəyə çatdı, dinin pənahı olan şahın hüquq səhifələrinə unutqanlıq qələmi çəkib böyük qoşunla Astarabada gəldi. O diyarın hakimi Sədrəddin xan bir dəstə qazini qaladan [onların üzərinə] göndərdi. Düşmənlərin sayı həddən və hüduddan ziyadə olduğu üçün qazilər geri qayıdıb şəhərə pənah gətirdilər. Din Məhəmməd qalanı mühasirə etməyi məsləhət bilməyib, öz vilayətinin yolunu tutdu. Bu xəbər Lar yaylağında [Bəhram] mirzəyə və əmirlərə çatdıqda Bədir xan, Hüseyncan sultan və Budaq xan Qacar Astarabad tərəfə sürətlə yürüdülər. Lakin Din Məhəmmədin çıxıb getdiyi [haqqında] xəbəri eşitdikdə Lar yaylağına qayıtdılar.

### Rumilərin gürcülərlə savaşına dair söhbət

Bu il Rum padşahı Sultan Süleyman Ərzurum hakimi Musa paşanı altmış sancaq əmiri ilə Gürcüstanı işğal etməyə yolladı. Rumilər fərmana uyğun olaraq, Davelinə hərəkət etdilər. Başı-açıq kimi tanınan Məlik Baqrat[2214] Daveli[2215] qalasını möhkəmlədib, aznavurların bir dəstəsini orada qoyaraq özü dağlıq və cəngəlliyə getdi. Rumilər qalanı mühasirə etdilər, on gün sonra [oranı] tutdular və hazırlıqlı qoşunla oradan Oltuya gəldilər. Oranın da qalasını araya aldılar. Yeniçərilər irəli gedib “sibə”ləri tərtib etdilər, top-tüfəngi[2216] və s. qala döyüşü ləvazimatını hazır etməklə məşğul oldular. Qala əhli məcburiyyət ucbatından döyüşə və vuruşa əl atdı.

O əsnada Başı-açıq [hakimi Məlik Baqrat] məkr və hiylə üzündən bir dəstə adamını çoxlu töhfələrlə Musa paşanın yanına göndərdi və [belə bir] xəbər verdi: “Bəndənin nə həddi var ki, xondgar həzrətlərinin qoşunlarına qarşı düşmənçilik edim. Əgər paşa geri dönərsə, o zaman qala açarlarını kimə əmr etsə, ona təslim edəcəyəm”. Paşa onun sözünə aldandı, Oltu qalası ətrafından köç edib Ərzuruma yollandı və bir sıra sancaq əmirlərini topun başına qoydu ki, onun ardınca Ərzuruma gəlsinlər.

Elə ki Başı-açıq [hakimi Məlik Baqrat] paşanın getməsindən xəbərdar oldu, Gürcüstanın digər sərdarları ilə birlikdə gözlənilməz bəla kimi top başında qalmış rumilərin üstünə töküldü, onların ətrafını və yan-yörəsini elə dairəyə aldı ki, min nəfərdən biri canını [oradan] sağ çıxara bilmədi. Ondan sonra sürətlə yürüyüb paşanı dəf etməyə yollandılar. Çaşt vaxtı ona çatdılar və həmlə etdilər. İti qılıncın yarası ilə rumilərin həyat damarını çıxardılar (qopardılar) və çölün səthini onların qanından lalə kimi [qırmızı] etdilər. Musa paşanı bir çox rumilərlə birlikdə qətlə yetirdilər və onların mallarını talan etdilər.

Musa paşanın qətli xəbəri Həmidə çatdıqda Xadim Əli Paşa Diyarbəkr qoşunu ilə sürətlə Gürcüstan tərəfə hərəkət etdi. O, həmin ətrafa çatdıqda Gürcüstan əmirləri öz vilayətlərinə getdilər. Əli paşa o diyarın kəndlərindən bəzilərini yandırıb Həmid tərəfə geri qayıtdı.

## 950-Cİ İLDƏ (06.04.1543 – 24.03.1544) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Və rumilərin gürcülərlə savaşı[2217]

Elə ki gürcülərin qələbəsi xəbəri Sultan Süleymana çatdı, Əli paşanı[2218] çoxlu ordu ilə Gürcüstana göndərdi. Onlar Qanlı-çəmən[2219] mövqeyində gürcülərə çatıb savaşdılar. Dilavərlərin həmləsindən hərb atəşi alışdı. Gürcülər güc gəlib Dəli Bəhaəddin Kürdün bayrağını ələ keçirdilər. Dəli Bəhaəddin soyunub gürcülərə həmlə etdi, öz bayrağını onlardan aldı və rumilərin qoşununa qatıldı. Dava-qırğından sonra gürcülər məğlub olub qaçmağa üz qoydular. Rumilərin əlinə çoxlu mallar düşdü və onlar öz diyarlarına qayıtdılar.

---

hangirlə, Əmir Kavusla və Əmir Məlik Bəhmənlə görüşüb, [onlardan] layiqli peşkəşlər alaraq sağlam şəkildə və qənimətlərlə birlikdə mirzənin ordusuna döndü”.

[2213] Bakı nüsxəsi: “Şahəli”.

[2214] Başı-açıq – Qərbi Gürcüstan ərazisində paytaxtı Kutaisi şəhəri olan tarixi İmereti vilayətinin türkcə adı. Baqrat – 1510-1548-ci illərdə Başı-açıq (İmereti) çarı olmuş III Baqratdır.

[2215] Tehran nəşrində yanlışlıqla Eli yazılmışdır. Biz Bakı nüsxəsi (181b) əsasında “Daveli” şəklində düzəliş vermişik.

[2216] Tehran nəşri: “Firəng top-tüfəngi”; Məclis nüsxəsi: “top və firəngi”.

[2217] Baroda nəşri: “Rumilərin gürcülərlə müharibə etməsi haqqında söhbət”.

[2218] Baroda nəşri və Bakı nüsxəsi: “Mütəmərrid Əli paşanı”.

[2219] Qanlı-çəmən – Türkiyənin şimal-şərqində, Qarsın Soğanlı dağlarının qərb tərəfində yerləşir.

Bu il dinin pənahı olan şah olduqca əzəmət və həşəmətlə Qəzvində qışlaq etdi. İran diyarı o həzrətin ədalətinin uğuru ilə bəzəndi. Rəiyyətin və camaatın hamısı əmin-amanlıq beşiyində asudə oldular və onun dövlətinin davamı üçün dua etməklə məşğul oldular.

## 951-Cİ İLDƏ (25.03.1544 – 14.03.1545) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Hümayun padşahın aləmin pənahı olan dərgaha gəlməsi

Bu il Hümayun padşah dinin pənahı olan şaha sığındı. Onun gəlişinin səbəbi budur ki, Şirxan Əfqan, Hümayun padşaha qarşı müxaliflik etməyə başladı. Padşah Hümayun o alçaq əfqanın üzərinə yollandı. Benqal[2220] sərhədində ona çatıb döyüş səfi tərtib etdi. Olduqca ağır bir hərb baş verdi. Hümayun padşah qeyri-məhdud qoşunlara malik olduğu üçün məğrur idi və o, "Huneyn [vuruşu] günündə çox olmağınız xoşunuza gəlmişdi"[2221] kəlməsinə əsasən, çox az olan düşmən qoşununa əsla diqqət yetirmirdi. Lakin onun xəbəri yox idi ki, "Neçə dəfə olub ki, az bir dəstə Allahın izni (iradəsi) ilə çox bir dəstəyə qalib gəlib! Allah səbr edənlərlədir!"[2222]. Xeyli savaşdıqdan sonra Şirxana qələbə üz verdi. Cağatay ordusu acınacaqlı məğlubiyyətə uğradı. Sultan Hüseyn mirzənin nəvəsi Mirzə Məhəmməd Zaman bir sıra əmirlərlə birlikdə Qanq çayında qərq oldu. Padşah pərişan və bədhal bir vəziyyətdə Lahora gəldi. Oradan isə əfqanların hərəkəti və qardaşlarının müxalifliyi səbəbindən Bəkrə gəldi. O vilayətin hakimi Mirzə Şahhüseyn ibn Şüca bəy Ərğun səadətin qapılarını öz üzünə bağlayıb asilik bürcündə inad bayrağı qaldırdı. Neçə dəfə ali mənşəli padşah etibarlı adamları Mirzə Şahhüseynin yanına göndərib onu həmrəylik yoluna riayət etməyə dəvət etsə də, faydası olmadı. Padşaha məlum oldu ki, o hüdudun qalalarını o mərdimazarın əlindən almaq çətindir. Buna görə də köç edib Qəndəhara yollandı. O diyarın hakimi Əsgəri mirzə, padşahın qardaşı idi. O, Hümayun padşahın gəlişindən agah olduqda xatirindən keçirdi ki, bacardığı tərzdə Hümayun padşahı və onun dövlət ərkanını əsir etsin. Padşahın tərəfdarlarından və sədaqətlilərindən olan bir şəxs Əsgəri mirzənin xidmətində idi. O, peşəsi zəlalət olan [Əsgəri mirzənin] niyyətindən xəbər tutub [Hümayun padşahın] ordusuna tələsdi və Şalü-Məstun[2223] vilayətində uca mərtəbəli astanaya gəlməyə müvəffəq olub Əsgəri mirzənin təqsiri barəsində halın keyfiyyətini ərz etdi. Hümayun padşah zərurət üzündən mallarını, əşyalarını və yüklərini o nahiyədə qoyub, otuz-qırx nəfər igid[2224] mülazimlə birlikdə o bədbəxtin qorxusundan kədər və xof karvanı ilə qeyri-məlum bir yolla köhlən atının yüyənini Sistan tərəfə döndərdi. "O gün insan qaçacaq öz qardaşından"[2225] əhvalı müşahidə olundu. Yolları qət etdikdən sonra sözügedən vilayətə çatdı. O vilayətin hakimi Əhməd sultan Şamlu əksər əyan-əşrəflə birlikdə yüksək şanlı padşahı qarşılamağa çıxdı. Onlar həmin vilayətin məkanlarından olan bir məkanda o həzrətlə görüşdülər və o padşaha layiq olan bir mənzildə onu qonaq etdilər. Zəmanə padşahı Əhməd sultanla birlikdə Herat səmtinə hərəkət etdi.

Elə ki Məhəmməd xan Hümayun padşahın gəlişindən vaqif oldu, Əli sultanı bol töhfələrlə onu qarşılama göndərdi. Zilqədə [ayının] 20-də, şənbə gününün[2226] səhər çağında Məhəmməd xan Heratda olan böyüklərlə, əyanlarla və b. qazilərlə Heratdan çıxıb, yaxşı əməl sahibi olan hökmdarı qarşılamağa tələsdi. Malan kəndində xan, bəzi oğulları və b. sultanlar (əmirlər) Padşah Hümayunla görüşdülər və o həzrətlə birlikdə şəhərə gəldilər. Zağan bağında Sultan Məhəmməd mirzə məiyyət və ordu ilə Hümayun padşahla görüşdü. Neçə gün dövlətmənd padşah Heratda qaldı, [daha sonra isə] səadət və uğurla ali taxtın ətəyinə yola düşdü. Hansı vilayətə çatdısa, əmirlər və sərdarlar bəndəlik mərasimini yerinə yetirib layiqli peşkəşlər çəkdilər. O, calal sahibinin (Allahın) himayəsi altında səadət və uğurla Reyə gəldikdə o diyarın hakimi Hüseyncan sultan Rumlu qohumları və nəsli ilə birlikdə [onu] qarşılamağa tələsib, büsatı öpmək şərəfinə nail oldu, ona peşkəş çəkdilər və yaxşı mənzillərdə qonaq etdilər. [Hümayun padşah] dinin pənahı olan şahın ordusunun bir fərsəx-

[2220] Benqal – Qanq və Brahmaputra çaylarının aşağı axarlarında tarixi vilayət. Hal-hazırda Qərbi Benqal (mərkəzi Kəlkətə şəhəri olmaqla) Hindistanın tərkibində ştatdır. Şərqi Benqal ərazisində isə paytaxtı Dəkkə şəhəri olmaqla müstəqil Banqladeş dövləti yerləşir.

[2221] *Qurani-Kərim, "Tövbə" surəsi, 25-ci ayə.*

[2222] *Qurani-Kərim, "Bəqərə" surəsi, 249-cu ayə.*

[2223] Məclis nüsxəsi: "Şamilü-Məspan". Bakı nüsxəsi: "Şali-Məstung".

[2224] Baroda nəşri: "əzəmətli".

[2225] *Qurani-Kərim, "Əbəsə" surəsi, 34-cü ayə.*

[2226] Yəqin ki, burada h. 950-ci ilin zilqədə ayının 20-si (14.02.1544) nəzərdə tutulur.

liyinə çatdıqda Bəhram mirzə, Sam mirzə, Qazı Cahan, Sevindik bəy Qorçubaşı, Bədir xan, Şahqulu xəlifə Möhürdar və b. ali mənşəli əmirlər onu qarşılamağa çıxdılar. Hər addımda dəstə-dəstə qoşun və məiyyət gəlib onunla görüşdü.

Xilafətin pənahı olan dərgahın yaxınlığına çatdıqda, öz atından aşağı enib bargaha doğru yeridi. Dinin pənahı olan şah, Padşah Hümayunu gördükdə, öz oturduğu çadırdan çıxıb, bir neçə addım irəli gəldi. İki günəşin yaxınlaşması və iki ulduzun görüşməsi baş verdi. Dinin pənahı olan şah, Hümayun padşahla birlikdə çadırın içinə gəldi və onlar münasib yerdə qərar tutdular. Onun (Hümayun padşahın) təqdim etdiyi hədiyyələr sırasında bir parça almaz vardı ki, çəkisi dörd tam üçdə iki misqal idi. Fələk şövkətli ordu Qürvə[2227] çəməninə doğru hərəkətə gəldi. O zaman Surluğun ruh oxşayan səthi hökmdarın nurunun gözəlliyindən rəngarəng asimanın təravətini aldı.

O diyarda[2228] dinin pənahı olan şah ov etmək məqsədi ilə atlandı. Elə ki cərgə bağlandı, çoxlu ahu, saysız maral və digər ov heyvanları təqdir torunun əsirinə çevrildilər və cahangir padşahın qılınc və ox zərbəsi ilə qətlə yetirildilər.

Nəzm

“Maral ox atışından həlak oldu,
O, yer öküzü kimi torpağın altının həvəsindədir.
Ahunun başı və buynuzu qana bələnmişdi,
Gül budağı tikanla dolu olduğu kimi, ona oxlar sancılmışdı.
İt ahulardan huşu alıb aparmışdı,
Onların qulaqları yoxluq yuxusuna getmişdi”.

Dinin pənahı olan şah böyük bir ziyafət təşkil edib Hümayun padşahı dəvət etdi və ona münasib yerdə [əyləşməyə] yer verdi. Yemək-içməkdən sonra ona nağd [pullar], cavahirat, daş-qaşla bəzədilmiş kəmərlər, zərbaftadan, məxmərdən, atlasdan və kəmxadan[2229] ibarət çoxlu qumaşlar, xeyli Firəng əmtəələri, döyüş əşyaları və alətləri, ərəb atları, təchiz olunmuş dəvələr, bəzisi qatara bağlanmış, bəzisi fərdi və yorğa olan çoxlu qatırlar, xeymə, alaçıq, təbil və bargah çadırı hədiyyə etdi. [Hümayun] padşahın vəkili olan Bayram xan Baharluya təbil və ələm bağışlandı. Pak etiqadlı padşahın ata-babalarının qəbirlərini ziyarət etmək arzusu Hümayunun nurlu qəlbində yer tutdu və o, Ərdəbil vilayətinə doğru hərəkət etdi. Təbriz və Ərdəbili seyr etdikdən sonra dinin pənahı olan şahın ordusuna qayıtdı. [Şah Təhmasib tərəfindən] ali hökm verildi ki, Şahqulu sultan Əfşar, Budaq xan Qacar, Sistan valisi Əhməd sultan, Çayan sultanın nəvəsi Ayqut bəy, Div sultanın oğlu Ədhəm bəy, Şahverdi bəy Keçəlin[2230] sərdarlığı ilə üç yüz qorçu və Məhəmməd xan Təkəlünün mülazimlərindən min süvari adlı-sanlı [Hümayun] padşaha yardım etmək üçün Zəmindavər və Qəndəhar vilayətinə getsinlər, o ərazisinin fəthindən sonra Kabil və Qəzneyn vilayətinə yollansınlar və o vilayəti də tutub Hümayun padşaha təslim etsinlər.

Adı çəkilən sərdarlar sözügedən vilayətə yola düşdülər. Onlar Gərmsirə çatdıqda Kamran mirzə tərəfindən Qəndəhar hakimi olan Əsgəri mirzə qalanı möhkəmləndirib xilaf bücründə əyləşdi və Kabilə ərizə göndərib Hümayun padşahın gəldiyini bildirdi. Mirzə Kamran, Qasım sultanla Əmir Xəlili dilavərlik meydanının süvarilərindən ibarət bir dəstə ilə Mirzə Əsgəriyə yardım etmək üçün həmin vilayətə yolladı. Elə ki bu xəbər uca məqamlı [Hümayun] padşaha çatdı, o, qızılbaş qoşunu ilə birlikdə savaş əzmi ilə sürətlə hərəkətə keçdi. Bir sıra əmirlər mənqəlay şəklində irəli getdilər. Düşmənlər də cürət və igidlik nümayiş etdirdilər. Süvarilərdən və piyadalardan ibarət şövkətli bir dəstə döyüş və vuruş xəyalı ilə qaladan çıxdı. Döyüş başladı. Hər iki tərəf döyüşdü və səy göstərdi. Fitnə və rəzalət atəşinin şölələnməsindən sonra Mirzə Əsgərinin astanasının qılınc qurşananları və dilavərlik meydanının çevik süvariləri qaçmağa üz qoyudular və qalaya pənah apardılar. Çoxlu əsgərlər qalanı mərkəz kimi araya aldılar. Ora elə bir qaladır ki, fələklər fələyinə başını çəkibdir və ruzigarın gözü onun mislini görməyibdir. Onun bürcünə yüksəlmək arzusu qeyri-mümkün bir xəyaldır.

---

[2227] Qürvə - Həmədandan şimal-qərbdədir.
[2228] Baroda nəşri: “O vaxtda”.
[2229] Kəmxa – naxışlı ipək qumaşın bir növü.
[2230] Məclis nüsxəsi: “Keçəl Şahverdinin”.

Nəzm

“Zəfərin yar olduğu, qələbə şüarlı ordu,
Oturdu ətəyində o qalanın.
Bu, elə bir qaladır ki, hündür göydəki günəş,
Neçə kəməndin köməyi ilə oraya doğru dırmanar.
Səma astanalıdır, fələk ətəklidir,
Onun divarından asimana kölgə düşür.
Küngürəsinin səfi asimana ucalır,
O, fəza bürclərinin tağına gülür.
Bir kəsin o qalaya yolu düşərsə,
Sanki günəş və ayın üzərinə ayaq qoyar.
Xəndəyi dərya kimi dərindir,
Hasarı səmaya gedib çatır”.

Qiyamət şövkətli qoşunun gəlişindən dağa zəlzələ və o güruhun canına vəlvələ düşdü. Mirzə Əsgəri və onun adamları əllərini oxla kamana atıb döyüşə başladılar. Səkkiz ay ərzində Hümayun padşah və dövlətsevər qazilər qalanı mühasirədə saxladılar. Əsgəri mirzə Kamran mirzənin yardımından ümidini üzdü, onun əhvalı üzərində zəiflik və sınıqlıq əlamətləri zahir oldu və o, üzrxahlıq etməkdən, şəfaət istəməkdən başqa çarə görmədi. Hümayun padşaha xeyirxah elçilər göndərdi və aman dilədi. Yaxşı əxlaqlı hökmdar özünü “Qəzəblərini udanlar”[2231] zümrəsindən qərar verərək, “İnsanların günahlarından keçənlər”[2232] dəstəsindən sayaraq, “Allah yaxşılıq edənləri sevər”[2233] [ayəsini] nəzərə alaraq qəzəbini boğdu. Mirzə Əsgəri və [onun] yardımçıları və tərəfdarları Qəndəhar məhbəsindən (mühasirədən) çıxıb, [Hümayun padşahın] feyz bəxş edən barmaqlarını öpmək iftixarına və şərəfinə nail oldular. Budaq sultan şəhərin içinə daxil olub şəhəri öz ixtiyarı altına aldı. Hümayun padşah və dinin pənahı olan şahın əmirləri Qəndəharda oturdular. Dörd gün sonra aləmi yandıran qazilər padşahın rüxsəti olmadan köç edib öz ölkələrinə yollandılar. Baxmayaraq ki, dinin pənahı olan şah Kabil vilayətini Kamran mirzədən almayınca geri dönməmələri haqqında hökm vermişdi.

Hümayun padşah beş min süvari ilə Qəndəhar nahiyələrində qalıb, öz əmirlərini çağıraraq məşvərət etdi. Sultan Hüseyn mirzənin nəvələrindən olan Uluğ mirzə ərz etdi:

- Yaxşısı budur ki, Qəndəharı Budaq xandan alıb, köçlərimizi və ailələrimizi orada qoyaraq Kabilə yollanaq.

Bu tədbir aydın ürəkli hökmdarın xoşuna gəldi. Uluğ mirzə məşhur dilavərlərdən üç yüz nəfərlə Maşur darvazası tərəfdən şəhərə yollandı. Əmir Hacı Məhəmməd Gugə[2234] bir dəstə bahadırla Kəndəgan darvazası yolundan həmin şəhərə doğru hərəkətə gəldi. O iki sərdar Qəndəhar darvazasına çatdıqda darvaza gözətçilərinin qafil olduqlarını gördülər və özlərini qalanın içinə saldılar. Budaq sultanın mülazimləri ərk qalasına pənah apardılar. Ondan sonra Hümayun padşah şəhərə gəldi. Budaq xan ərkdən aşağı enib, [Hümayun] padşahdan rüxsət alaraq dinin pənahı olan şahın dərgahına yollandı.

Elə ki Qəndəhar məmləkəti dinin pənahı olan şahın imdadı ilə yenidən Hümayun padşahın ixtiyarına keçdi, cağatay əmirləri dəstə-dəstə Kamrandan üz çevirib o həzrətə qoşuldular. Hümayun padşah xeyirxah adamların məsləhəti ilə Kabilə yollandı. O əsnada Qaraca bəy adlı-sanlı padşahın əlini öpmək şərəfinə nail olub müxtəlif lütfkarlıqlara layiq görüldü. Həmçinin o əsnada Qoç bəyin oğlu Şirəfkən Bahadır yaxşı silahlanmış min süvari ilə mərdimazar Kamrandan fərar edib orduya qoşuldu. Eləcə də Həzarə hakimi Xızır xan on min[2235] adlı-sanlı süvari[2236] ilə zəfər şüarlı qoşuna qatıldı.

---

[2231] *Qurani-Kərim, “Ali-İmran”, 134-cü ayə.*
[2232] Həmin ayə.
[2233] Həmin ayə.
[2234] Məclis nüxəsində “Gugə” əvəzinə “Kərkə” yazılmışdır.
[2235] Məclis nüsxəsi: “iki min”.
[2236] Baroda nəşri: “döyüşçü”.

Padşahın gəlişindən agah olan Mirzə Kamran Kabili qoyub fərar etdi. Hümayun padşah son dərəcə əzəmət və şövkətlə Kabilə daxil oldu. Həzarələr, əşirətlər və səhra sakinləri bol peşkəşlərlə Hümayunun hüzuruna gəlib onun büsatına enmək səadəti tapdılar.

Bu il iki ulduzun qovuşması baş verdi. Dinin pənahı olan şah Qəzvində səadət və calalla qışlaq etdi.

## 952-Cİ İLDƏ (15.03.1545 – 03.03.1546) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Damğana getməsi

Bu il dinin pənahı olan şah Qəzvin ətrafındakı Yeləgünbəd yaylağına gəldi, oradan Sultaniyyəyə yollandı və iki ay müddətində orada vaxtını keçirdi, oradan da Damğana getdi.

### Müxtəlif əhvalatlar

Bu il Din Məhəmməd sultan bir dəstə özbəklə müqəddəs Məşhədə getdi. Şahqulu sultan Ustaclunun bir dəstə mülazimi şəhərdən çıxmışdılar və Türüq ətrafında gəzirdilər ki, birdən-birə gözlənilməz bəla kimi Din Məhəmməd və çoxlu özbəklər peyda oldular. Onun (Şahqulu sultanın) qoşun böyüklərindən olan altmış nəfər qazi, o cümlədən Əhməd ağa Eşikağası, Möhürdar və digərləri qətlə yetirildilər[2237]. [Özbəklər] Nişapura yollandılar və şəhəri dağıtmaqla, bəndələrə əzab verməklə məşğul oldular. İyirmi gün sonra isə [onlar] öz diyarlarına yola düşdülər.

Bu il dinin pənahı olan şah Qəzvində qışlaq etdi.

Həmçinin bu il Təbrizdə taun oldu.

### Ölümlər

Əmir Müizzəddin Məhəmməd İsfahani İraqi-Əcəmin yüksək dərəcəyə malik seyidlərinin ən dindarı, ən mömini, ən zahidi, ən biliklisi və ən fəzilətlisi idi. Fiqh elmində, xüsusilə də ibadətlər kitabında tam məharət əldə etmişdi. Əksər fiqhi məsələləri zəmanə müctəhidindən (Şeyx Əli ibn Əbdüləalidən) öyrənmişdi. Gəncliyinin çiçəklənən dövründə Beytullahı (Kəbəni) ziyarət etmək şərəfinə nail olmuşdu. Zəmanə müctəhidi, Mir Qiyasəddin Mənsurun sədarət mənsəbindən çıxarılmasına bais olduğu vaxt, elə həmin gün Mir [Müizzəddin Məhəmməd] həzrətlərinin gözəl vəsflərinin bir qismini əlahəzrətin (Şah Təhmasibin) məclisində söyləmişdi və ərzin zirvəsinə (şaha) yetirmişdi ki, bu gün o həzrətdən (Əmir Müizzəddin Məhəmməddən) başqa seyidlər, əziz nəqiblər və alimlər cümləsindən heç kimin bu yüksək mərtəbəyə və adlı-sanlı mənsəbə (sədarət vəzifəsinə) ləyaqəti çatmır. O zaman Mir [Müizzəddin Məhəmməd] İsfahanda idi. Onun [şah] hüzuruna gəlməsi haqqında qəzavü-qədər kimi cərəyan edən fərman verildi. Onun ali dərgaha gəlişinə qədər zəmanə müctəhidi həzrətləri onun üçün naiblər və vəkillər təyin etdi, möhür və nişan (tovqi) tərtib etdirdi. O, səkkiz il müddətində sədarət [vəzifəsini icra] etdi, pak şəriətə rəvac vermək üçün, aydın dinin nizam-intizamı üçün çox çalışdı və qeyri-məhdud cəhd zühura gətirdi. Bidətin aradan qaldırılması baxımından sədrlərdən heç biri onun qədər cəhd və səy göstərməmişdi. Həzrət məxsusən tiryəkxanaların, əxlaqsızlıq yuvalarının, şərabxanaların, kefləndirici içki yerlərinin dağıdılması, oyun və qumar alətlərinin sındırılması, əxlaqsızlığın, pozğunluğun və mülhidliyin sıxışdırılması yönündə çox iş görmüşdü. Bu rütbəyə (sədarət mənsəbinə) baxmayaraq, o həzrətin təbiətinə zarafatcıllıq qalib gəlmişdi və ondan ürək oxşayan lətifələr və zarafatlar zühura yetmişdi. O həzrətin gözəl xilqəti, təvazökarlığı və sadəliyi elə bir mərtəbədə və dərəcədə idi ki, iki dilli qələm onun heç cüzi qismini də bəyan sapına düzə bilməz. Amma Mövlana Rüknəddin Məsud Təbib Kazeruni tərəfindən o həzrətə qarşı törədilmiş məkr və hiylə[2238] nəticəsində, dinin pənahı olan şahın könlü ondan incidi və o həzrəti sədarətdən çıxardı. Ondan sonra İmam Rzanın ərş mərtəbəli məqbərəsində qərar tutub öz vaxtını dini elmlərin tədrisinə, [Allaha] itaətə və ibadətə sərf etdi. Bu il o, şərəfli Hərəmeyni[2239] təvaf etməyə yollan-

---

[2237] Baroda nəşri və Bakı nüsxəsi (184b-185a): "Bu il Din Məhəmməd sultan bir dəstə özbəklə Məşhədə gəlib, müqəddəs Məşhədin hakimi olan Şahqulu sultan Ustaclunun mülazimlərindən altmış nəfəri qətlə yetirərək Nişapura yollandı...".

[2238] Baroda nəşri: "məkr və narahatçılıq".

[2239] Hərəmeyni-şərifeyn (ərəbcə: "iki şərəfli ziyarətgah") – müsəlman aləminin ən müqəddəs ziyarətgahı olan Məkkə və Mədinə şəhərləri nəzərdə tutulur.

dı və Bəsrə yolunda vəfat etdi. Şərəfli cəsədini Kərbəlada dəfn etdilər. Əsərləri cümləsindən "Əqsami-miyah" ("Suların qisimləri")[2240] [adlı] bir risaləsi vardır. Vəfat tarixi [əbcəd hesabı ilə] "Xeyrün-nas" ("İnsanların ən xeyirlisi") [ifadəsindən] məlum olur[2241].

Mövlana Sultan Məhəmməd Sədəfi Astarabadi məşhur şairlərdən idi. O cənabla Mövlana Heyrətinin arasında həmişə şeir bəhsi vasitəsilə münaqişə mövcud idi. Bu ilin rəcəb ayında (08.09. – 07.10.1545) o, sükunət möhürünü dodağına qoydu (vəfat etdi). Əsərlərindən "Şərhi-mətale" ("Mətlələrin şərhi"), qəzəllər və qəsidələr divanı vardır.

Bu il Məntəşa sultan Ustaclu öz ölkəsi olan Naxçıvanda ani ölümlə dünyadan köçdü.

## 953-CÜ İLDƏ (04.03.1546 – 20.02.1547) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Haqtanımaz Əlqasın müxalifliyi

Əlqas bir müddət Şirvanda hakimiyyət sürdükdən sonra beynində xudbinlik və qürur buxarına yol verib, bu qürur oturacağında bir neçə günlük nursuz hakimiyyət ucbatından tüğyan silkində məğrur oldu və qara ürəklilər kimi hidayət nurundan uzaq düşdü. O, köhnə hüququ unudaraq və özünə bir dəstə adam qoşaraq tüğyanın təməlini qoydu, tam cidd-cəhdlə və sözlə ifadəsi mümkün olmayan bir səylə inadkarlıq və qiyamçılıq alətlərini hazırladı, öz vəlinemətinin (Şah Təhmasibin) haqqını aradan qaldırmaq üçün çalışdı və "nankorluq küfrdən daha betərdir" [kəlamının] mənasından qafil oldu. Onun çöhrəsində nəhs üsyan xalı zahir oldu və onun işinin üzərinə qiyam tikişi düşdü. Bu məna hamıya aydın və məlum oldu. Dinin pənahı olan şah məiyyət və ordu ilə Təbrizə yollanıb Ürgəncoğlunu[2242] Əlqasın yanına göndərdi. Sözügedən şəxs ona [şahdan] sərt cavablar söylədi. Əlqas mirzə dinin pənahı olan şahın hərəkətindən narahatçılıq ənginliyinə daldı. O, öz anası Xanbəyi xanımı və oğlu Sultan Əhmədi yalvar-yaxar etmək üçün dərgaha göndərdi.

"Yəqin oldu ki, zəhməti nadanlıqdandır,
İşinin sərəncamı peşmançılıqdır.
Anasına belə dedi ki, ey yaxşı qadın,
Təqsirimin üzrünü yalnız sən istəyə bilərsən.
O ağıllı banu oldu onun rəhbəri,
Çünki bala öz anasının ardınca gedər".

Xanbəyi xanım Əlqasın sözlərini [şaha] ərz etdi. Məğzi belə idi: "Həzrət [şah] mənim vəlinemətimdir. Qaragün bəxtimin vasitəsi və [məni] pis öyrədən yaramaz adamların fəsadı ilə bulaşdığım puç əməldən və yersiz müxaliflikdən xəcalətli və peşmanam. Mükəmməl şahanə hüsn-rəğbətə ümidvaram. Əgər hökmdarın mərhəməti bəndənin günahını əfv edərsə, öz həddimi bilib, bundan sonra ayağımı tabeçilik yolundan kənara qoymaram, xidmətkarlıq və fədakarlığa riayətdən heç bir dəqiqə də əl çəkmərəm". Dinin pənahı olan şah da onun təqsirlərindən keçib, yüksək səviyyəli əmirlərdən Seyid bəy [ibn] Məhəmməd Kəmunəni, Sevindik bəy Qorçubaşını, Şahqulu xəlifə Möhürdarı, Bədir xanı və Ərdəbil mütəvəllisi Məsum bəyi Əlqasın anası ilə Şirvana yolladı. Onlar Cavadda Əlqasla görüşdülər və ona and içdirdilər ki, bir daha tabeçilik yolundan addımını kənara qoymasın, hər il xəzinəyə min Təbriz tüməni çatdırsın və səfərbərlik (yasaq) üçün min süvari göndərsin.

Bu tərəfdən, dinin pənahı olan şah Səhənddən köç edib Təbrizə gəldi. Orada Əlqasın yaxın adamlarından Bərəkət xəlifə Bəydili öz qohumlarından təxminən qırx nəfərlə birlikdə Əlqasdan fərar edib dinin pənahı olan şahın hüzuruna yetdi. O əsnada Təbrizdə əfşar və zülqədər tayfaları arasında münaqişə baş verdi. Hər iki tərəf döyüş əsləhəsi geyinib döyüşə hazırlaşdılar. Dinin pənahı olan şah onları lütflə və qətiyyətlə məzəmmət etdi. Buna görə də əmirlər sülhə və barışığa meyilli oldular. Şahqulu xəlifi Zülqədər, İbrahim xan Zülqədər, Əli sultan Tatıoğlu Zülqədər, Sevindik bəy Qorçubaşı Əfşar, Kirman hakimi Şahqulu sultan Əfşar və Mahmud xan Əfşar dövlətxanaya gəldilər və əhd etdilər ki, ömürləri boyunca bir-biriləri ilə xilaf və nifaq məqamında durmayacaqlar.

[2240] Baroda nəşri: "Təqsimi-miyah" ("Suların təqsimi").
[2241] "Xeyrün-nas" = 952 h.
[2242] Məclis nüsxəsi: "Gəncoğlunu"; Bakı nüsxəsi: "Ərgəncoğlunu".

Ondan sonra dinin pənahı olan şah saysız-hesabsız bir ordu ilə Gürcüstana yollanıb, Şuregeldən keçərək Aqşəhrə gəldi. Həmin günlərdə sübhdən şamacan və səhərdən axşamacan, səxavətlilərin əlindən gümüş yağdığı kimi, dayanmadan buluddan [qar] yağdı və soyuğun fəlakətindən dağ düşmənin ürəyi kimi qorxudan əsdi. Belə halda zəfər mahiyyətli padşah gavurların üzərinə gecə basqını etdi[2243]. İslam qoşunu bəd aqibətli gavurların məskəninə yetişdikdə, cihad qılıncını intiqam qınından çəkib onların qanından qarın üzünü gül rənginə boyadılar, çoxlu inək və qoyun qənimət götürdülər və o bədbəxtlərin evlərinə od vurdular. O zaman günəş Oğlaq bürcünün axırında (yanvar, 1547) idi. Şaxtanın şiddətindən Kür çayı buz bağlamış, şüşə kimi olmuşdu. Qarın çoxluğundan dağ zirvəsi ilə səhra və çöl eyni bərabərdə olmuşdu. Sanki Kamal İsmayıl[2244] bu zaman üçün demişdir:

“Çiyidin pambıqda gizləndiyi kimi,
Dağların cismi qar içində gizlənmişdir”.

O zaman bu sətirlərin müəllifi, Əmir sultan Rumlunun nəvəsi Həsən bir dəstə rumlu və çepni qorçuları ilə imansız gavurlardan ibarət bir dəstəyə düçar oldu. Bu həqir (Həsən bəy Rumlu) Şahqulu adlı çepni qorçusu ilə birgə həmlə etdik. Onları pərən-pərən salıb bir qismini yaraladıq və öldürdük. Neçə əsir tutub geri qayıtdıq. Bizə yoldaş olan qazilər mükəmməl dərəcədə “igid” olduqları üçün bir addım belə irəli atmadılar[2245].

Dinin pənahı olan şah Aqşəhrdən köç edib Tebediyə yollandı. Yol əsnasında Zəkəm və Girem hakimi Ləvənd bəy və Gürcüstan hakimi Başı-açıq (Məlik Baqrat), sultanların pənahı olan dərgaha yetdilər və şahanə nəvazişlə şərəfləndirildilər. Başı-açıq xələt geyib öz ölkəsinə döndü. Ləvənd bəy neçə gün səadətli padşahın xidmətində qaldı və hökmdar məclisinin dövlətindən və səadətindən nəsibini aldı. Dinin pənahı olan şah dəyərli hədiyyələr, bol ənamlar, yorğa atlar və şahanə xələtlər [bağışlamaqla] onu əzizlədi. Daha sonra o, rüxsət alıb öz diyarına yollandı.

Dinin pənahı olan şah köçhaköçlə Gəncəyə gəldi və Gəncədən köç edib Bulaq[2246] mövqeyində dayandı. O mənzildən [Şah Təhmasib] İbrahim xan Zülqədəri, Hüseyncan sultan Rumlunu, Gögcə sultan Qacarı, Şahverdi sultan Ziyadoğlu Qacarı və Xoca Basanı[2247] yaxşı silahlanmış beş min süvari ilə Əlqasın ailəsinin və köçünün yerləşdiyi Şamaxıya sürətli yürüş etmək üçün yolladı. Çoxsaylı qazilər Həzrət Pərvərdigara təvəkkül edib, Kür çayını keçərək Şamaxıya yönəldilər. Əlqasın ordusunun əmiri olan Mehtər Dövlətyar [bundan] xəbərdar oldu. O, Əlqasın ailəsini və köçünü götürüb Gülüstan qalasına getdi. Əmirlər, dövlər ərkanı və Bəhram şövkətli əsgərlər Şamaxını çalıb-çapdılar və Gülüstan qalasını araya aldılar. Əmirlərin getməsindən sonra dinin pənahı olan şah, [atdıqları] parlaq oxların yarası ilə uçan qartala qanad saldıran və [vurduqları] toppuzların zərbəsi ilə möhkəm dağı başı üstə aşıran qaniçən qazilərdən və zəmanə igidlərindən ibarət bir dəstə ilə,

Nəzm

“Bu, sərxoş fillər kimi coşqun bir ordu idi,
Hamısının əlində nizə, gürz və xəncər vardı”,

Qoyun-ölümündən keçib Ərəşə[2248] yollandı.

“Şirvan torpağına şəfəq saldı,
Süleyman nişanlı, tac bəxş edən hökmdar.
Ordunun tozu aya yüksəldi,
Yer öküzünün beli əyildi.

---

[2243] Şah Təhmasibin Gürcüstan üzərinə bu ikinci yürüşü gürcü knyazları Levondun və Ləvasanın Azərbaycana qarşı viranedici basqınlarının qisasını almaq üçün həyata keçirilmişdi *(Seddon, şərhlər, s.274).*

[2244] Kamal İsmayıl (Kəmaləddin İsmayıl ibn Məhəmməd İsfahani) – XIII əsrin İran şairidir. 635 / 1237-ci ildə monqol-tatarların İsfahana hücumu zamanı öldürülmüşdür. 12 min beytlik divanı vardır *(P.Makulu. Ədəbi məlumat cədvəli, s.192; F.Cahanbəxş. Zindeginameyi-şe`rü şairani-irani, s.237).*

[2245] Burada igid sözü məcazi mənada işlədilmişdir və Həsən bəy Rumlu öz döyüş yoldaşlarının qorxaqlığını ələ salmaq üçün bu ifadədən istifadə etmişdir.

[2246] Baroda nəşrində və Bakı nüsxəsində: “Yulaq”. Goranboy rayonunda Yolpaq adlı kənd vardır *(R.Əliyeva və d. Azərbaycan toponimlərinin ensiklopedik lüğəti. Bakı, 2007, II c., s.280).*

[2247] Bakı nüsxəsi: “Xoca Baysan”.

[2248] Ərəş – indiki Yevlax rayonunun Xaldan kəndindən 3 km. şərqdə yerləşmiş orta əsr şəhəri.

Atların nallarından zəmin qərarsız oldu,
Lakin asimanda tozanaq qərar tutdu".

[Şah] köçhaköçlə Əli-Şəbana[2249] yola düşdü. O məkandan Gülüstan qalası ətəyində olan Süleyman Çələbini[2250] cövşən geymiş altı yüz nəfər igidlə Dərbənd qalası tərəfə göndərdi. Onlar sözügedən qalanın bir fərsəxliyində Əlqasın yanından gələn Qəbələ kələntərinə çatdılar. Qazilər onları məğlub etdilər və o bədbəxt qövmdən təxminən otuz nəfəri qətlə yetirdilər. Daha sonra qala istiqamətində hərəkət bayrağını qaldırdılar. Sarı Qiymasib[2251] və Dəli Qiymasib Dərbənddən [onlarla] savaşmağa gəlsələr də, döyüşdən və vuruşdan sonra qaçış yolunu tutub qalaya sığındılar. Süleyman Çələbi geri qayıdıb Samur çayına gəldi.

### Müxtəlif əhvalatlar

Bu il ətrafdan və yan-yörədən, Dəşti-Qıpçaq türklərindən, səhra sakinlərindən və dağ sərdarlarından [bəziləri], məsələn, Sultanəli[2252] bəy Qaytaq[2253] və Qarabudaq[2254] ali taxtın ətəyinə gəlib bəndəlik ərz etdilər və baş əydilər. O həzrət onlara hörmət və rəğbət göstərib, dəyərli xələtlər, zərbafta paltarlar, qızıl qılınc kəmərləri və ərəb atları bağışladı.

Həmçinin bu il Rum padşahı Sultan Süleyman Bəsrənin işğalı üçün çoxlu ordu göndərdi. O diyarın valisi Abdulla Münzir qaladan çıxıb gecəyədək rumilərə müqavimət göstərdi. Amma onlara tay olmadığını görüb, şəhəri qoyaraq fərar etdi. Rumilər Bəsrəni ələ keçirdilər.

### Ölümlər

Sultan Cağatay gözəlliyin və təravətin kamilliyinə malik bir cavan idi. Yanağı təzə-tər gül ləçəyini qısqandırır, rüxsarının parıltısı aya və Müştəriyə həsəd verirdi. Rüxsarı gül kimi sulu, saçları qıvrım və eşmə idi. Sanki yanağının səhifəsinə "Biz insanı ən gözəl biçimdə yaratdıq!"[2255] hikmətinin naqqaşı icad pərgarı ilə ənbər qoxulu bir dairə çəkmişdi. Rüxsarı açılmış gül kimi və çöhrəsi iki həftəlik ay kimi idi.

"Sanki sərv lalədən zivər bağlamış,
Ərğəvandan[2256] libas geyinmişdir.
Onun iki türk gözü ürəklərə pusqu qururdu,
İki qaşı ciyərlərə ox sancırdı".

Amma o, murad bağından ümid gülü dərməmiş, fanilik xarına giriftar oldu (öldü).

"Onun gül ləçəyindən elə ki bənövşə çıxdı,
Fəlakətdən ona həmlə etdi xəzan küləyi.
O vaxt ki gül qönçədən bayıra çıxdı,
Qönçə kimi kəfənin içində nihan oldu".

Bülbül təbli Mövlana Qasım Kahi[2257] [bu hadisəni] belə tərənnüm etmişdir:

"Sultan Cağatay gözəllik gülşəninin gülü idi,
Lakin əcəl onu rizvana[2258] çəkib apardı.
Gül mövsümündə bu bağdan səfərə çıxdı,
Ürəklər o qönçə sifətlinin qəmindən dəliliyə qərq oldu.
Onun tarixini matəmli bülbüldən soruşdum,
Naləyə gəldi və dedi ki, "gül" "bağ"dan xaric oldu"[2259].

---

[2249] Məclis nüsxəsi: "Əli-Çobana"; Bakı nüsxəsi: "Əli-Şiyana".
[2250] Bakı nüsxəsi: "Süleyman Çepni".
[2251] Məclis və Bakı nüsxələri: "Qiymas".
[2252] Nuruosmaniyyə, Məclis və Bakı nüsxələri: "Həsənəli".
[2253] Qaytaq – Dağıstanın dağətəyi ərazisində yerləşən, indiki Qaytaq (Kaytaq) rayonunun, qismən də Qayakənd, Serqokalinsk və Daxadayevsk rayonlarının ərazilərini əhatə edən tarixi mahal.
[2254] Baroda nəşrində və Bakı nüsxəsində: "Qaraqubad".
[2255] *Qurani-Kərim, "Tin" surəsi, 4-cü ayə.*
[2256] Ərğəvan – gözəl qırmızı bir gül adı.
[2257] Qasım Kahi Nəcməddin – XVI əsr şairlərindəndir. Buxarada anadan olmuş, Hindistanın Əkbərabad şəhərində 988 / 1580-ci ildə vəfat etmişdir. Şeirlərini farsca yazmışdır *(P.Makulu. Ədəbi məlumat cədvəli, s.70).*
[2258] Rizvan – islam mətnlərinə görə, cənnətin gözətçisi və qapıçısı olan mələyin adı..

Mövlana Məsud Kaşinin oğlu Mövlana Kəmaləddin Hüseyn fəzilətli və inceliklərı bilən bir həkim idi. Doğru rəyinin qanunu xəstəliklərin şəfasının vasitəsi idi və parlaq zehninin qaydalar külliyyatı qəziyyələri dəf edən sursat idi. Dinin pənahı olan şahın təbibliyi mənsəbi möhtərəm atasından sonra o cənabda qərar tutmuşdu. Həmişə sultanın (Şah Təhmasibin) qayğıkeşlik nəzəri altında idi və xaqanın hüsn-rəğbətlərinə şamil olmuşdu. Bu il o, vəfat etdi.

## 954-CÜ İLDƏ (21.02.1547 – 10.02.1548) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Əlqas mirzənin Çərkəz tərəfə getməsi, onun o diyardan geri qayıtması, əmirlərə məğlub olması və Rum tərəfə getməsi

Əlqas əmirlərlə görüşdükdən sonra altı min süvari və piyada ilə Çərkəz tərəfə yönəldi. O, ailəsini və köçünü Şamaxıda qoyub, təcili surətdə hazırlaşaraq Dərbəndə yollandı. Qalada qoyduğu anası Xanbəyi xanım [onun ardınca] Çərkəz diyarına üz tutsa da, havanın şaxtalı olması səbəbindən bir iş görə bilməyib geri qayıtdı. [Əlqas] Şəki hakimi Dərviş Məhəmməd xanın qardaşı Şahnəzəri bir dəstə mülazimlə qicdavul[2260] [təyin] etdi. Çərkəz camaatından bir dəstə ona rast gəldi. Şahnəzər ayağını möhkəm tutub şiddətli döyüş etdi. [Lakin] axırda çərkəzlərin nizə zərbəsi ilə atdan yıxılıb öldürüldü. O mərəkədə Birvəndi[2261] ağa Rumlu və Əlqas mirzənin mülazimlərindən bir çoxları qətlə yetirildilər. Elə ki çərkəz qoşunları Əlqasın qoşunlarına qalib gəldilər, onlar piyadalardan və süvarilərdən ibarət çoxlu qoşun toplayıb qorxusuz-hürküsüz bir şəkildə Əlqasın qarşısında döyüş səfi bağladılar. Əlqas da səf tərtib etməklə, mizraqların və qılıncların hazırlanması ilə məşğul oldu. [Qızılbaşların] hamısı birdən onlara həmlə etdilər. Çərkəzlər qaçmağı qənimət bildilər. Əlqasın mülazimləri onları təqib edib o bədbəxt qövmdən təxminən üç yüz nəfəri qətlə yetirdilər və hərəkət yüyənlərini Dərbəndə doğru çevirdilər.

O hüduda çatdıqdan sonra xəbər yetişdi ki, dinin pənahı olan şah gəlmiş[2262], [Əlqasın] hərbçilərinin ailə və köçünü ələ keçirmiş və indi də yaxşı silahlanmış otuz min süvari ilə birlikdə döyüşə və vuruşa hazırdır. Elə ki Əlqas bu xəbəri eşitdi, öz yaxın adamlarından olan Sarı Qiymasiblə Dəli Qiymasibi[2263] çoxsaylı bir dəstə ilə Şahverdi sultan Ziyadoğlu Qacarın, Məhəmmədi[2264] bəy Türkmanın, Süleyman bəy Çələbi Çepninin və Məhəmməd bəy Şirbəxt oğlu Talışın üzərinə göndərdi. Əmirlər bu ordu ilə Samur çayı kənarında savaşıb qalib gəldilər. Bu xəbər haqtanımaz Əlqasa çatdıqda Məhəmməd bəy Əfşarı bir dəstə yaramazla birlikdə Rüstəm bəyə və Peykər bəyə qarşı döyüşə göndərdi. Əmirlər Qəbələ ətrafında onlarla vuruşub [onları] məğlub etdilər və o bədbəxt qövmdən yüz altmış nəfəri qətlə yetirdilər. Məhəmməd bəy çoxlu məşəqqətlə aradan çıxdı.

Həmçinin o günlərdə [Əlqas mirzə] Çoban bəy Ayçəkoğlunu dil tutmağa göndərdi. Sözügedən şəxs əmirlərin ordusunun ətrafına çatdıqda, təsadüfən Şahverdi sultan Ziyadoğlu seyrə çıxmışdı. [Şahverdi bəy] ona rast gəldi və onu tutub aləmin pənahı olan dərgaha yolladı. O həzrətin fərmanı ilə onu öldürdülər. Eyni zamanda Kor Söhrab Zülqədər ələ keçirilib cəzalandırıldı (öldürüldü).

Əlqasın Dərbəndə gəlişi xəbəri dinin pənahı olan şaha çatdıqda Şahqulu xəlifə Möhürdarı, Bədir xan Ustaclunu, Hüseyncan sultan Rumlunu və Çıraq sultan Ustaclunu müxaliflərin qarşısında durmuş əmirlərin yardımına göndərdi. Əlqas müzəffər əsgərlərin hərəkətindən xəbərdar olduqda onu müqayisəyəgəlməz qorxu bürüdü və Xınalıq[2265] tərəfə fərar etdi. Onun qoşunu sədaqət və dövlətsevərlik qədəmi ilə dəstə-dəstə şahın əmirlərinə birləşdi. Əlqas Xınalıqdan köç edib Samur çayı kənarında dayandı. Əmirlər sürətlə onun üzərinə

---

[2259] "Bağ" sözünün əbcəd cəmi 1003-ə, "gül" sözünün əbcəd cəmi isə 50-yə bərabərdir. Beləliklə, "bağ"dan "gül"ü çıxdıqda, 953 rəqəmini alırıq ki, bu da hadisənin, yəni Sultan Cağatayın öldüyü ilin tarixidir. Nəsrabadi təzkirəsində bu şeir Mir Mixçə adı ilə məşhur olan Mirzə Əmaniyə aid edilmişdir *(Ə.Nəvai. Şərhlər, s.1304)*.

[2260] Bakı nüsxəsi: "qaravul". Qicdavul – ordunun arxasını mühafizə edən dəstə mənasındadır *(Nəvai, şərhlər, s.1321)*.

[2261] Məclis nüsxəsində belə yazılmışdır. Lakin digər nüsxələrdə "Pərvəndi", Bakı nüsxəsində "Pərvənd"dir. Bəlkə də, "Pirverdi" olmalıdır.

[2262] Nuruosmaniyyə və Məclis nüsxələri: "təşrif gətirmiş".

[2263] Nuruosmaniyyə nüsxəsi: "Sarı Qiymasla Dəli Qiyması"; Baroda nəşri: "Sarı Qiymasibi və Qiymasibin oğlunu".

[2264] Bakı nüsxəsi: "Məhəmməd".

[2265] Xınalıq – Azərbaycanın Quba rayonunda, Quba şəhərindən 60 km. cənub-qərbdə, Baş Qafqaz və Yan silsilələri arasında, çökəklikdə yerləşən kənddir *(ASE, X c., s.89)*.

yürüdülər. Şahverdi bəy Ziyadoğlu və Məhəmməd bəy Türkman əmirlərin mülazimlərindən təxminən iyirmi nəfərlə Samur çayı kənarında qəflətən Əlqasa yetişdilər.

“Bağda meyvələrin bir azının əvvəlcə yetişdiyi kimi,
Meydana yetişdi [qoşunun] mindən biri.
Onların atlarının hamısı yorulmuşdu,
Təsviri atlar kimi hər biri getməz olmuşdu”.

Əlqas çəkməsiz atlanıb fərar vadisinə tələsdi. Sayları qar qədər olan qazilər ildırım kimi sudan keçdilər və qılınca, oxa və kamana əl atıb döyüşə başladılar.

“Oxdan elə atəş alovlanırdı ki,
Fələkdəki mələyin qanadını yandırırdı”.

Şahqulu xəlifə Möhürdarın mülazimi Satılmış ox zərbəsi ilə Əlqası yaraladı. Əlqasın qürur və xəyal küləyindən yüksəlmiş lovğalıq və təkəbbür atəşi yatdı və o, məğlub olub tam məşəqqətlə özünü qalaya çatdırdı. Onun nökərlərinin çoxu qazilərin əlində giriftar oldular. O, xidmətində qırx nəfər olduğu halda şamxal qövmünün yanına gedib, Azaq yolundan dənizə (gəmiyə) oturaraq Kəfəyə yollandı. Oradan da İstanbula getdi.

### Gülüstan qalasının fəthi barəsində söhbət

Mehtər Dövlətyar qalanın mətinliyinə, azuqənin bolluğuna, yardımçılarının və tərəfdarlarının çoxluğuna güvənib darvazaları bağlamışdı.

Nəzm

“O əyri fikirli, napak əqidəli şəxs,
Öz ətrafına xətadan bir xəndək xətti çəkdi.
Qalanın qapısını açmadı o bəsirətsiz,
Qapını uğurlu bəxtin üzünə bağladı”.

Dinin pənahı olan şah buyurdu ki, qala kənarında mövqe tutsunlar, topdan və zərbzəndən [ibarət] qala tutmaq ləvazimatını hazırlasınlar. [Şah Təhmasib] Həmzə bəy Kaşanə Bicənoğlunu[2266] elçi kimi o dövlətsizin yanına göndərdi ki, onu qaladan çıxarsın. [Lakin] onlar həmin biçarəni bürcün başına aparıb qazilərin gözləri önündə tikə-tikə etdilər. Təxminən üç ay ərzində müzəffər əsgərlər qalanı mühasirədə saxladılar və bəzi vaxtlarda döyüş baş verdi. Hər iki tərəfdən fitnə və qüsur cıdırının süvariləri ox və tüfənglə öldürüldülər. Nə mühasirədəkilərə sevinc üz verdi, nə də [qala ətrafında] hazır olanlara fəth fərəhi nəsib oldu. Axırda murad qapılarını açan və pis xilqətli nadürüstlərin təməlini viran edən (Allah) elə bir səbəb etdi ki, qala fəth olundu.

O günlərdə qaladakı qadınlar ona (Mehtər Dövlətyara) münasibətdə bədgüman oldular. Bir gün Mehtər Dövlətyarla Təbriz tamğaçısı Xoca Miricanın[2267] oğlu Xocəgi ərkin (iç qalanın) o biri ucuna getmişdilər. Həmin zaman qadınlar qalada olan çadır kəndiri ilə bir dəstə şamlu qorçusunu yuxarı çəkdilər. Qorçular qılınclarını sıyırıb gözlənilməz bəla kimi müxaliflərin üstünə getdilər. Mehtər Dövlətyarı cəmi qala adamları ilə birlikdə əsir etdilər və dinin pənahı olan şahın dərgahına gətirdilər. O həzrətin hökmü ilə onlar cəzalandırıldılar. Qalanın xaraba qoyulması haqqında hökm verildi. Şahqulu xəlifə Möhürdar və Hüseyncan sultan Rumlu Dərbənddən keçib Qaytaq vilayətinə basqın etdilər, onların mallarını və əşyalarını, azını və çoxunu, böyüyünü və kiçiyini qarət etdilər. [Daha sonra] oradan uğurla və səadətlə, salamatlıqla və qənimətlərlə əmirlərin ordusuna qayıtdılar.

### Dərbənd qalasının Tanrının yardımı ilə fəth edilməsi haqqında söhbət

Əlqasın fərarı [xəbəri] dinin pənahı olan şaha çatdıqda ali əmr verildi ki, Bəhram mirzə, Abdulla xan və b. şücaətlilər əmirlərə qoşulub Dərbənd qalasını əhatə etsinlər. Əmirlər fərmana uyğun olaraq, qalanı araya aldılar. Köhnə Şahverdi qala kutvalı idi. O, qalanı möhkəmləndirdi. Fərman verildi ki, dəmir pəncəli la-

[2266] Məclis nüsxəsində “Bicənoğlu”, digər nüsxələrdə “Sancaqoğlu” yazılmışdır.
[2267] Baroda nəşri: “Mirican” əvəzinə yanlışlıqla “Əmir Siçan” yazılmışdır.

ğımçılar ("nəqəbçilər") lağım qazımağa başlasınlar və topçular top-tüfəng atmaqla məşğul olsunlar. İki-üç ay bu işi icra etdilər, bürcləri top zərbəsi ilə viran etdilər və qala divarını ələk kimi deşik-deşik etdilər. Köhnə Şahverdi dinin pənahı olan şahın dərgahına qasidlər göndərib canına aman istədi. Dinin pənahı olan şah onun günahlarını əfv etdi. Köhnə Şahverdi Xanbəyi xanımla birlikdə [qaladan] çıxıb aman tapdı. O zaman Sülut[2268] qalasının hakimi Məsih Şirvani xidmətkarlıq kəmərini bağlayıb, dərgaha gələrək qalanı təslim etdi.

Şirvan vilayəti yenidən dinin pənahı olan şahın ixtiyarına keçdikdə, dinin pənahı olan şah Şirvan məmləkətinin tamamını özünün əziz, rəşid və hörmətli oğlu, aləmin və aləm sakinlərinin şahzadəsi olan İsmayıl mirzəyə həvalə etdi və Gögcə sultan Qacarı ali mənşəli padşahzadənin xidmətində qoyub [onu] o həzrətin lələsi [təyin] etdi. Ondan sonra hərəkət bayrağını Təbrizə tərəf qaldırdı və şaban ayının 26-da (11.10.1547) Təbriz dövlətxanasına cah-calalla nazil oldu. O müəzzəm şəhərin əyan-əşrəfi, ümmətləri və böyükləri fələyə bənzər dərgaha tələsdilər və peşkəşlər təqdim etdilər.

### Qayıtmış sultanın Dərzi Davudla[2269] vuruşması

Bu il Rum padşahı Sultan Süleyman tərəfindən Pasin hakimi olan Dərzi Davud Ələşkərddə olan Qayıtmış bəy Xınıslunun üstünə rumilərin çoxsaylı bir dəstəsi ilə birlikdə gecə basqını etdi. Qazilər pərakəndə idilər. Əksəriyyəti yuxuya getmişdi. Gözlənilmədən rumilər sürətli yürüş edərək onların üzərinə ağır yuxu kimi basqın etdilər və alpavut [tayfasının] adamlarından təxminən yüz nəfəri qətlə yetirdilər. Qayıtmış bəylə Uluxan[2270] bəy Səədlü özlərini savaş meydanına atdılar və böyük bir hərb baş verdi. Azsaylı dəstə (qızılbaşlar) belə bir çoxsaylı qoşuna (rumilərə) qələbə çaldı[2271]. Təxminən yeddi yüz nəfəri[2272] qətlə yetirdilər və onların başlarını Təbrizə, aləm sakinlərinin pənahı olan dərgaha göndərdilər.

### Vəli sultan Zülqədərin Kürdüstan əmirləri ilə müharibə etməsi

Bu il Kürdüstan əmirləri Rum padşahı Sultan Süleymanın fərmanı əsasında beş min süvari ilə Urmiyaya gəldilər. Dinin pənahı olan şah tərəfindən o vilayətin hakimi olan Vəli sultan Zülqədər yaxşı silahlanmış üç yüz süvari ilə qaladan çıxıb düşmənin çoxluğundan qorxmadı. O, iti qılıncını sıyırıb, Kürdüstan ordusunun mərkəzinə hücum edərək ilk həmlədə [onların] bir dəstəsini [qırıb] torpağa tökdü. Vəli sultanın hücumunu müşahidə edən Kürdüstan əmirlərinin ürəyini tam qorxu bürüdü və onlar öz diyarlarına tərəf fərar etdilər. Vəli sultan Zülqədər o bədbəxt qövmün ardınca yollandı və talançılıqla məşğul olan bir çox kürdləri qətlə yetirib başlarını aləmin pənahı olan dərgaha göndərdi.

### Hümayun padşahın Bədəxşan padşahı Mirzə Süleymanla savaşması və Kamran mirzənin Hümayun padşaha qarşı müxaliflik etməsi[2273]

Bu il Hümayun padşah qələbə ayətli bayrağını Bədəxşan tərəfə qaldırdı. O vaxt Toxarıstan hakimi olan Mirzə Süleyman[2274] bu xəbəri eşidib, Xüttəlan, Qunduz və Bəğlan ordusunu cəmləyərək Kabil ordusu ilə vuruşmaq əzmi ilə hərəkətə gəldi. Kəndəran[2275] mövqeyində həmin iki qiyamət əlamətli qoşun yaz buludu kimi coşaraq və gurlayaraq bir-birinə çatdılar və həmlə küləyi ilə döyüş atəşini alovlandırdılar.

Beyt

"Gürzlə, kəməndlə və nizə ilə hücum etdilər,
Sındırdılar, bağladılar və yıxdılar".

Atəş saçan qılıncın parıltısı cahanı işıqlandıran günəş kimi [şəfəq] saçdı və əjdahaya bənzəyən nizənin şöləsi aləmin ərazisini Bədəxşan ləlinə döndərdi. Nəhayət, qələbə yeli Hümayun padşahın bayrağının

---

[2268] Ellis nüsxəsi: "Şülut". Sülut qalası İsmayıllı rayonu ərazisindədir.
[2269] London nüsxəsi: "Dürdi Davud"; Baroda nəşri: "Düzdi Davud".
[2270] Baroda nəşrində yanlışlıqla "Əlvənd xan" yazılmışdır.
[2271] Bu cümlə "Qurani-Kərim"in "Bəqərə" surəsinin 249-cu ayəsinə işarədir.
[2272] Məclis nüsxəsi: "yüz əlli nəfəri"; Bakı nüsxəsi: "yüz nəfəri".
[2273] Ə.Nəvainin nəşrində 955-ci il hadisələrinin burada başladığı göstərilsə də, bu bölgü yanlış olduğundan biz Ç.N.Seddonun nəşrindəki bölgüyə üstünlük veririk.
[2274] Məclis nüsxəsi: "Mirzə Salman".
[2275] Bu yerin adı bütün nüsxələrdə boş buraxılmışdır. Yalnız Bakı nüsxəsində vardır.

pərçiminə əsdi. Mirzə Süleyman fərar vadisinə tələsdi. Padşah Hümayun o diyarı ələ keçirdi. Mirzə Süleyman üzrxahlıq və yalvar-yaxar qapısından içəri girdi. Zəfər sahibi olan padşah növbəti dəfə o diyarı ona verdi. Hümayun padşahın olmadığı müddətdə azğın Kamran Kabilə gəlib, padşahın ailəsini və köçünü ələ keçirərək o diyarı tutdu və dinin pənahı olan şahın Hümayunla göndərdiyi Vələd bəylə Dəli Qasım Türkmanı[2276] tutub lüt-üryan etdi.

Bu xəbər ali məqamlı padşaha çatdıqda çoxlu oldu ilə Bədəxşandan Kabilə yönəldi. Ali məiyyət dağdan və səhradan keçdikdən sonra Kabil ətrafında dayandı. Mirzə Kamran şücaətlilərdən [ibarət] bir dəstə ilə hiddətlə şəhərdən çıxdı və o zəmində əsgərlər qarşı-qarşıya gəldilər. O iki sərdarın hər biri döyüş səfi tərtib etdi. Ondan sonra igidlər mübarizə meydanına ayaq qoyub ox atmağa və qılınc çalmağa əl atdılar. Mirzə Kamranın qoşunu məğlub oldu. O, çoxlu zəhmətlə özünü şəhərə saldı. Hümayun padşah məiyyət və ordu ilə o ətrafda dayandı və həmin zaman dəfələrlə ağır döyüşlər baş verdi.

Kamran mirzə o əsnada Şirəfkən Bahadırı üç min süvari ilə bir gecə şəhərdən çıxarıb istədi ki, yolu bağlasın və ordubazar camaatının padşah ordusuna bol-bol taxıl gətirməsinə imkan verməsin. Bu xəbər ali məqamlı padşaha çatdıqda Əmir Qaracanı çoxsaylı bir dəstə ilə onları dəf etməyə yolladı. Əmir Qaraca bir dəstə dilavərlə gözlənilməz bəla kimi o dövlətsizlərin üzərinə töküldü. Şirəfkən Bahadırı səkkiz yüz süvari ilə birlikdə qətlə yetirdilər. Hümayun padşah, Qaraca bəyi göndərəndən sonra şəhər ətrafından köç edib qalanı mərkəz kimi araya aldı və nə bayırdan, nə içəridən gecə basqını edilməməsi üçün ordunun önündə və arxasında xəndək qazdırdı. Mirzə Kamran müxaliflik vadisinə qədəm qoyub, nifaq təməlini möhkəmlədərək hər gün lovğalıq və qürur küləyi ilə döyüş və vuruş atəşini alışdırıb son dərəcə şücaət nümayiş etdirdi. Neçə aydan sonra Mirzə Kamran öz ruzigarının çöhrəsində talesizlik və bəxtsizlik əlamətlərini müşahidə etdi və o həzrətin hüzuruna təkrar-təkrar elçilər göndərib xəbər verdi ki, müzəffər ordu [mənə] yol versin, [mən] bargaha gəlim. Padşah Hümayun bu xahişi məmnuniyyətlə qəbul edib fərman verdi ki, heç bir yaradılmış (canlı) ona hücum etməsin! Mirzə Kamran bir dəstə mülazimlə ali rütbəli padşaha itaət halqasını qulağına taxıb qaladan çıxdı və uğurun məskən saldığı astanaya üzrxahlıq etməyə gəldi. Padşah Hümayun onun təqsir dəftərinə əfv fərmanı yazıb onu şahzadələr silkində müntəzəm etdi.

## Müxtəlif əhvalatlar

Bu il dinin pənahı olan şah Əlqasın mülazimlərini dərindən araşdırdı. Onlardan hansılar ki xəyanət və nankorluq nişanələri nümayiş etdirmişdilər, cəzaya çatdırıldılar.

Həmçinin bu il içində, əhvalının səhifəsi üzərində dəfələrlə vəfasızlıq və nifaq əlamətləri zahir olmuş Həsən[2277] bəy Şamlu övladları ilə birlikdə giriftar oldu (həbs edildi)[2278].

Yenə bu il Div sultan Rumlunun oğlu Ədhəm bəy Rumlu elçi sifəti ilə Dəkən[2279] padşahı Nizamülmülkün[2280] yanına göndərildi.

## Ölümlər

Ağa Rüstəm Ruzəfzunun oğlu Ağa Məhəmməd olduqca səxavətli və xeyirxah idi. Bu il o, fani dünyadan köçdü. Qardaşı oğlu Ağa Söhrab əl-ayaq atsa da, bir iş görə bilmədi.

---

[2276] Bakı nüsxəsində səhvən "Qasım bəyin oğlu Vələd bəy" yazılmışdır (192a).

[2277] Baroda nəşri: "Hüseyn".

[2278] Məclis nüsxəsi: "əhvalının səhifəsi üzərində dəfələrlə vəfasızlıq və nifaq əlamətləri zahir olmuş Həsən bəy Şamlu cəzaya çatdırıldı".

[2279] Dəkən (Dekan) – Hindistanda yarımada.

[2280] Nizamşahlar sülaləsi 1490-1633-cü illərdə mərkəzi Bombeydən şərqdə yerləşən Əhmədnaqar şəhəri olmaqla Hindistanın Dəkən yarımadasının şimal-qərb hissəsində mövcud olan Əhmədnaqar sultanlığında hakimiyyət sürmüşlər *(СИЭ, т. X, Москва, 1967, с.201).* 952 / 1545-ci ildə Nizamşahların hökmdarı Bürhan (1508-1553) özünün Xurşah ibn Qubad əl-Hüseyni adlı elçisini Şah Təhmasibin sarayına göndərmiş, həmin elçi 19 il müddətində Səfəvilər dövləti ərazisində qalmış və 971 / 1563-1564-cü ildə Hindistana qayıdaraq 1565-ci ildə orada vəfat etmişdi. Xurşahın yeddi məqalədən ibarət "Tarixi-elçiyi-Nizamşah" ("Nizamşah elçisinin tarixi") adlı salnaməsi Azərbaycanın və bir sıra digər Şərq ölkələrinin tarixini öyrənmək üçün dəyərli mənbədir (bax: *О.А.Эфендиев. Азербайджанское государство Сефевидов в XVI веке, с.17-18*).

## 955-Cİ İLDƏ (11.02.1548 – 29.01.1549) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Aləm sakinlərinin şahzadəsi İsmayıl mirzənin Bürhan Şirvani ilə savaşı haqqında söhbət[2281]

Bu il Şirvan sultanlarının nəvələrindən olan Bürhan hədsizlik və tüğyan cibindan üsyan başını çıxarıb, ayağını doğru yoldan kənara qoyaraq Qaytaqdan[2282] Şirvana gəldi. Elə ki bu xəbər aləmin və aləm sakinlərinin şahzadəsi, qalibiyyət sahibi İsmayıl mirzəyə çatdı, çoxlu ordu ilə o yaramazı dəf etməyə yollandı. Filan[2283] mövqeyində Bürhan çoxlu adamlarla cəngəllik kənarında çəpərlər tərtib edib, qarşıdurmaya və vuruşmaya hazırlaşaraq inad bayrağını qaldırdı. Bir dəstə qazi qabaqdangəlmişlik edib, ali bayraqların gəlişindən öncə həmin yağı, tüğyançı və azğın camaatla məşğul olaraq dava-qırğın atəşini alovlandırdılar və alışdırdılar. O əsnada yüksək şanlı şahzadə böyük bir qoşunla hərb meydanına çatdı. Qazilərin kos və şeypurunun haykүyündən və şirvanlıların vəlvələsindən, fəryadından və iniltisindən dövr edən fələk tasına cingilti düşdü. Axırda "De ki, haqq gəldi, batil yox oldu. Çünki batil yoxluğa məhkumdur!"[2284] hökmü ilə o həzrətə müqavimət göstərməyə tab gətirmədilər.

Beyt

"Şirvanın taqət beyni qarmaqarışıq oldu,
Necə ki, işıqdan sərsəmlilərin [beyni] qarışır".

Bürhan bildi ki, xoşbəxtlik kələfinin ucunu əldən verib və ruzigar tərsinə dönüb. O, idbar üzünü fərar vadisinə çevirdi, ilan kimi çalan və atəş kimi yandıran oxun zərərindən balıq kimi yerə girdi, döyüşkən şahzadənin xofundan cüyür kimi arxasını çevirib aradan çıxdı, o həzrətin bayrağındakı aslanın qorxusundan tülkü kimi dava-qırığından qaçdı, hərb atəşinin və döyüş girdabının dəhşətindən sel kimi səhraya tələsdi. Elə iti qaçırdı ki, səba küləyi yeyin atla onun yel ayaqlı atının tozuna belə çatmazdı. Enişdə sudan, yoxuşda atəşdən daha cəld idi. Sanki onun külək ayaqlı, tozanaq xasiyyətli kəhəri od xilqətinə tutuşub və onun balıq kimi gedən atı çay içində qaçsa da tərə qərq olar. Qazilər onları təqib edib onun adamlarından bir çoxlarını qətlə yetirdilər və başlarını bədənlərindən ayırıb [İsmayıl] mirzənin atının ayağı altına atdılar.

O əsnada xəbər gəldi ki, Sultan Süleyman[2285] Əlqas mirzə ilə birlikdə Təbrizə hərəkət edir. [İsmayıl] mirzə həzrətləri dinin pənahı olan şahın ordusuna yollandı. Mirzənin getməsindən sonra Bürhan Şirvanı boş gördü və Kuhistandan (Dağıstandan) Şamaxıya gəlib o diyarı ələ keçirdi.

### Rum padşahı Sultan Süleymanın haqtanımaz Əlqasla darüssəltənə Təbriz tərəfə gəlməsi[2286]

Bu il Sultan Süleyman Əlqasla ittifaqda Engirüsdən, Əflaqdan, Bosnadan, Serbdən, Moradan, Qaraboğdandan, İredostdan[2287], Anadoludan, Məntəşa-elindən, Qaramandan, Mərəşdən, Hələbdən, Şamdan, Misirdən, Hicazdan, Yəməndən, Diyarbəkrdən, İraqi-Ərəbdən və Kəfədən topladığı müqayisəyəgəlməz bir qoşunla əsləhədən, cəbbədən, cövşəndən, topdan, tüfəngdən və ərradələrdən ibarət tamam yaraqla köçə-köçə Təbrizə yollandı. Sanki "məntəqətül-büruc"u və "müəddəlün-nəhar"ı mehvərə çəkmişdilər, yaxud "daireyimiliyi-küllini" və "marət bil-əqtabül-ərbəə"ni bir-birinin üzərinə çəkmişdilər[2288].

Nəzm

"Arabalar yola düşüb, ordunun tozu
Halə kimi ayın çevrəsində çadır qurub.

---

[2281] Məclis nüsxəsində 955-ci ilin hadisələri buradan başlayır.

[2282] Tehran çapında Qaytaq əvəzinə yanlışlıqla "Qaytan" yazılmışdır.

[2283] Bu döyüş Dərbənd yaxınlığındakı Filan kəndində baş vermişdir *(S.Aşurbəyli. Şirvanşahlar, s.343).* Bu yerin adı Ç.N.Seddonun nəşrində "Filan", Ə.Nəvainin nəşrində "Qəblan", Məclis nüsxəsində "Xilan", Bakı nüsxəsində isə "Milan" kimi yazılmışdır.

[2284] *Qurani-Kərim, "İsra" surəsi, 81-ci ayə.*

[2285] Tehran çapında səhvən "Sultan Hüseyn" yazılmışdır.

[2286] Ə.Nəvainin nəşrində yanlış olaraq 956-cı il hadisələrinin buradan başladığı göstərilmişdir. Ç.N.Seddonun nəşrində və Bakı əlyazmasında isə buradan 955-ci il hadisələri başlayır.

[2287] Rodos adası nəzərdə tutulur.

[2288] Bu cümlədə dırnaq içində qeyd olunan ifadələr astronomiyaya aid terminlərdir. Belə ki, Şərq astronomları fəzada doqquz xəyali dairə çəkmişlər və bunları "dairəhayi-əzimə" ("böyük dairələr") adlandırmışlar. "Məntəqətül-büruc" bunların ikincisi, "müəddəlünnəhar" birincisi, "daireyi-mili" səkkizincisi, "marət bil-əqtabül-ərbəə" isə üçüncüsüdür (daha ətraflı bax: *M.Müin. Fərhəngi-farsi, II c., s.1494*). Müxtəlif ölkələrdən toplanmış və müxtəlif silahlarla təchiz olunmuş Osmanlı ordusunu bir yerə cəmləşdirilmiş möhtəşəm fəza dairələri ilə müqayisə etməkdə salnaməçinin məqsədi Sultan Süleymanın qoşunlarının əzəmətini göstərməkdir.

Bir qaladır, lakin bir yerdən başqa yerə gedir,
Fələk bürcü kimi dilkeş və dilrübadır".

Dinin pənahı olan şah kinli rumilərin gəlişindın agah olduqda darüssəltənə Təbrizdən döyüş əzmi ilə çıxdı, Şənbi-Qazanda cah-calalla dayandı və ordu toplanışı üçün təxminən bir ay o məkanda qaldı. O həzrət düşmənin [keçəcəyi] yolun üstünü yandırıb-yaxdı ki, orada taxıldan və otdan əsər-əlamət qalmasın. Təbriz əhalisi qanovları və kəhrizləri bağladı ki, onların (rumilərin) içməsi üçün kifayət edəcək qədər su tapılmasın. [Şah Təhmasib] Abdulla xan Ustaclunu, Bədir xan Ustaclunu, Hüseyncan sultan Rumlunu, Şahverdi sultan Ziyadoğlunu və Əli sultan Təkəlünü Mərəndə göndərib, özü şəxsən nəfis vücudu ilə Əşkənbər[2289] yaylağına yönəldi. Abi-Şur (Acısu) kənarında aləm sakinlərinin şahzadəsi İsmayıl mirzə Şirvan qoşunu ilə zəfər nişanlı orduya qoşuldu.

Xondgar Divrigi yolundan Bargiriyə[2290] gəlib, Üləməni bir dəstə rumi ilə Van qalasını əhatə etməyə göndərdi. [Özü isə] oradan Təbrizə tərəf hərəkətə gəldi və Xoy qəsəbəsindən Əli paşanı, Məhəmməd paşanı, Əhməd paşanı, Heydər paşanı və Əlqas mirzəni qırx min süvari ilə Mərənd çəmənindəki adlı-sanlı əmirlərin üzərinə sürətlə yürüş etməyə göndərdi. Bu tərəfdən Abdulla xanı, Şahverdi sultan Ziyadoğlunu və Əli sultanı qaravulluğa göndərdilər və peşəsi qələbə qazanmaq olan qazilər Kərdbişədə[2291] Rum qoşununun ön dəstəsinə çatdılar. [Tərəflər] bir-birilərinə hücum etdilər və meydanın tozu Fərqədan [ulduzlarının] başlarına oturdu. Tozanağın çoxluğundan günəşin çeşməsi örtüldü.

Nəzm

"Zaman sərvərlərinin ordusunun tozundan,
Zəmin asimanla bir-birinə qarışdı.
O döyüş meydanında axan qan selindən,
Bağlanmışdı qorxaqların qaçış yolu".

Şahverdi sultan mərdanə döyüşüb bir çox rumiləri qətlə yetirdi. Lakin Rum əsgərlərinin sayı qızılbaş qoşunlarından çox idi və [onlar] dalğalanan dəniz kimi dəstə-dəstə bir-birinin ardınca gəlib çatırdılar. Ona görə də əmirlər aciz qalıb dağa pənah apardılar. Bu xəbər qəflətən gecə vaxtı yüksək şanlı əmirlərə çatdı. Onlar Hüseyncan[2292] sultan Rumlunun vəkili olan Təbət ağanı iki yüz nəfər qazi ilə bu xəbəri yoxlamağa yolladılar. Əmirqeyb bəy Ustaclu da döyüş əhlinin bir dəstəsi ilə yola düşdü. Onlar Rum qoşununun ön dəstəsi ilə vuruşa-vuruşa əmirlərə tərəf üz tutdular. Əlqas mirzə və paşalar Mərənd çəməninə çatdıqda o zaman artıq Abdulla sultan və b. sultanlar köç edib getmişdilər və yalnız yaxşı təchiz olunmuş iki min nizədar süvari [rumilərə] basqın etmək xəyalı ilə [orada] qalmışdı. Onlar döyüş meydanına üz qoydular və [geri çəkilən] qazilər yüyənlərini dartıb hərb etdilər. Rumilər elə bildilər ki, bu pusqudur və cürətlərini itirdilər. [Lakin] vuruşub-çalışdıqdan sonra bunun pusqu olmadığını öyrəndilər. Onlar cəsarətlənib hücum etdilər. Qazilər döyüşə-döyüşə özlərini savaş meydanından çıxardılar və rumilər [onların] bu igidliyindən xoflandılar və qorxdular. Əmirlər və b. qazilər Əşkənbər mənzilində qələbə nişanlı orduya qoşuldular. Xuzistan, Fars, Kirman və İraqi-Əcəm əmirləri hələ gəlib çatmadıqları üçün onların da gəlib toplanması məqsədi ilə Əşkənbər çayından Əhər çayına endilər. Sultan Süleyman Yam keçidindən keçib, Təbrizə gələrək Çərəndabda dayandı.

Əlqas mirzə eyşlə abad olmuş bağa möhnət və fəlakət gətirdi. [Rumilərin] Təbrizdə olduqları dörd gün ərzində onların heyvanlarının və dəvələrinin yemi yarpaqlardan və ağac qabığından ibarət oldu. Dörd gündə təxminən beş min at, qatır və dəvə yoxluq otlağına tələsdi (öldü). Həmin bir neçə gündə küləyin şiddəti səbəbindən toz-torpaq o dərəcədə günəşin aynasını örtdü və qaraltdı ki, uzaqgörənlərin nəzərində gündüzü gecədən ayırmaq müyəssər olmadı. Taxılın azlığı, qidanın və yeməyin çatışmamazlığı, heyvanların ölməsi ucbatından, cüyür şikar edən süvarilər ac qaldılar və ahu rəftarlı piyadalar qüvvətsizlik və ölüm torunda giriftar oldular. Buna görə də Rum ordusu hücum çəkib şəhəri qarət etməyə başladı. Təbriz əhli Qülzüm və Üm-

[2289] Əşkənbər yaylağı – Cənubi Azərbaycanın Qaracadağ (Qaradağ) vilayətində yerləşir (*Хамдаллах Казвини. Нузхат ал-кулуб, с.46*).
[2290] Bargiri (Muradiye) – Türkiyənin şərqində, Van şəhərindən 77 km. şimal-şərqdə yerləşən yaşayış məntəqəsi.
[2291] Nuruosmaniyyə və Məclis nüsxələri: "Kərdəbişədə".
[2292] Məclis nüsxəsi: "Həsəncan".

man dənizlərində gəmisi sınmış, tufanın dalğalarından gəmiləri şikəst olmuş və ürəkləri candan çıxmış [adamlar] kimi fəryad və fəğanı asimana çatdırdı.

Bu xəbər Sultan Süleymana çatdıqda Rüstəm paşanı göndərdi ki, ordunu qarətdən çəkindirsin və şəhərə gəldikdə car çəkdirdi ki, heç kəs rəiyyətə əziyyət verməsin. Buna görə də fitnə sakitləşdi. Dinin pənahı olan şah qızılbaş dilavərlərini rumilərin dörd tərəfində qaravulluq etməyə göndərdi. Qazilər rumilərin ordusunun kənarına gedib adamlar [əsir] tutdular və ordubazarda onları dar ayağına çəkdilər.

Sultan Süleyman qızılbaşların igidliyindən pərişan və heyran oldu, qeyri-mümkün xəyalı başından çıxardı və çəkdiyi zəhmətdən peşman olub geri qayıtmaqdan başqa çarə görmədi. Gecələrdən bir gecə onun ordusunda qızılbaşların yaxınlaşması haqqında xəbər yayıldı. [Həmin gecə] o, yükləri və əşyaları Rum diyarına yolladı, [özü isə qızılbaş] ordusunun qorxusundan gündüzə qədər at üzərində oturdu və düşənbə günü, rəbiüssani [ayının] 24-də (02.06.1548)[2293] yola düşdü. Təbrizin yetimləri, çapavulçuları və lotu-potuları onun məiyyətinə və qoşununa təcavüz əllərini uzatdılar və onun adamlarından bir çoxlarını qətlə yetirdilər. İbrahim xan və Məhəmməd bəy Mosullu Türkman onun ardınca gedib, Şam və Diyarbəkr paşası ilə və Mərəş paşası ilə ağır döyüş edərək qüdrətli dövlətin gücü ilə onlardan Ayıntab əmirini iki yüz nəfərlə birlikdə öldürdülər.

Sultan Süleyman hər gün üç-dörd fərsəx yol gedirdi. Onun qoşunları qızılbaşların qorxusundan ordugahdan ayrılmırdılar. O, Kürdüstan yolundan Van qalası üzərinə getdi. O vaxt dinin pənahı olan şah tərəfindən qalanın kutvalı olan Şahəli sultan Çepni döyüşə və vuruşa başladı. Rum ordusunun hamısı birdən hücum edib top-tüfəng atmağa başladılar. Daha əvvəl Adilcevazda tökmüş olduqları yeddi badliclə altı topu həmin zaman gətirib qala bürclərini atəşə tutdular.

Nəzm

“Tüfəng aşiq kimi qara bəxt ilə,
Cahanı qara etdi ahın tüstüsündən.
Ox uçuşundan səmada bulud atılıb-düşürdü,
Lakin onun yağdırdığı dolunun hamısı iti peykan kimidir.
Asimandan yetərincə kin daşı gəldiyi üçün,
Zəmin bitişdi uca göylərə”.

Şahəli sultan Çepni namərdliyinin çoxluğundan qalanı təslim etdi. Sultan Süleyman Van hakimliyini İsgəndər paşaya tapşırıb Diyarbəkrə yollandı.

Dinin pənahı olan şah Əşkənbər yaylağında xondgarın Təbrizdən çıxıb getdiyini eşitdikdə pəncşənbə günü, həmin ayın 28-də (06.06.1548)[2294] basqın etmək əzmi ilə köçhaköçlə yola düşdü. Cəsur qazilər və qələbə nişanlı qoşunlar o bədbəxt güruhun bir dəstəsini qətlə yetirdilər[2295]. [Qızılbaş qoşunları] şənbə günü, rəcəb [ayının] 6-da (11.08.1548) Xoy şəhərində cah-calalla dayandılar. İbrahim xan və b. yüksək şanlı əmirlər çoxlu qoşunla zəfər nişanlı orduya qoşuldular. Çaharşənbə günü, həmin ayın 10-da (15.08.1548) qalib hökmdar Çaldıran çəməninə gəldi. O məkanda Kirman valisi Şahqulu sultan və Mahmud xan Əfşar üç min süvari ilə astananı öpməyə yetişdilər.

Cah-calallı [hökmdarın] qulağına çatmışdı ki, [Sultan Süleyman] Məhəmməd xan Zülqədərin qardaşı Əli bəyə paşalıq verib və Osman Çələbi Qullarağasını dörd min nəfərlə Gürcüstan sərhədində yerləşən Qars qalasını təmir etməyə göndərib. Buna görə də dinin pənahı olan şah igid və şərəfli oğlu İsmayıl mirzəni Gögcə sultan Qacarla birlikdə onları qırıb-biçməyə göndərdi. Aləm sakinlərinin şahzadəsi ordudan ayrılıb, o çoxsaylı qövmün üzərinə əcəl kimi sürətlə hərəkət etdi. Belə ki, səba [küləyinin] çaparı yeyin atla onun yel ayaqlı atının tozuna çatmazdı. O, enişdə sudan və yoxuşda atəşdən daha yeyin idi.

---

[2293] Qeyd olunan miladi tarix düşənbə (bazar ertəsi) gününə deyil, şənbə gününə təsadüf etmişdir. Osmanlı mənbələrinə görə, Sultan Süleyman 17 iyul 1548-ci ildə Təbrizə daxil olmuş və 1 avqustda buranı tərk etmişdir *(R.Kılıç. Kanuni devri Osmanlı – İran münasebetleri. İstanbul, 2006, s.266-269).*

[2294] Göstərilən miladi tarix pəncşənbə (cümə axşamı) gününə deyil, çərşənbə gününə təsadüf etmişdir. Bu abzasdakı tarixlər Bakı nüsxəsində yoxdur (195b).

[2295] Məclis nüsxəsi: “Dinin pənahı olan şah Əşkənbər yaylağında xondgarın Təbrizdən çıxıb getdiyini eşitdikdə onun ardınca hərəkət bayrağını yüksəltdi və İsmayıl mirzəyə çoxlu qazilərdən [ibarət] bir dəstə ilə sürətli yürüş etmək əmri verib Qars qalası tərəfə göndərdi. Rumilər orada təmir işləri aparırdılar. Hökmdarın özü isə nəfis vücudu ilə Muş səhrasına doğru yola düşdü. Qələbə şüarlı qoşunlar Adilcevazla Əxlatı qarət edib zəfər bayrağını yüksəltdilər”.

Beyt

"Yamacdan yamaca, dağdan dağa çapdı,
Atını təpədən təpəyə atdandırdı".

Sanki onun külək ayaqlı, sürətli [atı] Səməndər kimi od tutmuş və onun balıq kimi gedən atı çay içində qaçsa da, tərə qərq olmuşdu. O, [bu minvalla] şənbə günü, həmin ayın 21-də (26.08.1548) düşmən ordugahına çatdı. Büraq[2296] əndamlı atını mahmızlayıb ortaya Səməndər kimi atəş şöləsi saldı.

Beyt

"Ovcunda bir şimşək tutub, üzünün önündə bir bulud,
Başına bir ay qoyub, altında bir asiman var".

Bəhram [kimi] intiqamçı əsgərlər o qövmdən iki min nəfəri[2297] gedər-gəlməzə göndərdilər və Amasyadan, Toqatdan, Sivasdan, Aqşəhrdən[2298], Ərzincandan, Bayburddan, Kəmaxdan[2299], Tərcandan, Ərzurumdan və o hüdudun və ölkənin başqa yerlərindən gətirilmiş işçilərdən, fəhlələrdən və sənət əhlindən təxminən beş min nəfər digərini qətlə yetirdilər. O qaragünlərin bir dəstəsi can qorxusunda özlərini qalaya saldılar. [Axırda] qorxu-hürkü seli qala sakinlərinin vüqarının təməlini dağıtdı. Onlar aman istədilər və qaladan çıxdılar. O yaramazların başçısı olan Osman Çələbi altı yüz nəfərlə[2300] ali mənşəli şahzadənin dərgahına gəldi. Görüş əsnasında o axmaq sifətli divanə gözlənilmədən qılınca əl atıb Toyqun bəy Qacarın çiyninə vurdu və çoxsaylı güruhun hamısı birdən yüksək dərəcəli şahzadəyə həmlə etdi. O həzrət əsla yerindən tərpənmədi. Bu səbəbdən onların qətli haqqında ali hökm verildi. Onların hamısını qətlə yetirdilər və qalanı xarab edib əzəmətli orduya yollandılar.

O zaman Bəhram mirzə çoxlu ordu ilə Həmədandan və aləm sakinlərinin şahzadəsi İsmayıl mirzə Qars qalasından [gəlib] fələk şövkətli orduya qoşuldular. Şahqulu sultan Əfşarı çoxlu qoşunla o hüdudun uluslarına basqın etməyə göndərdilər. Onlar Əxlatın bütün əşirətlərini qarət edib təxminən beş min at, yüz min qoyun və əlli min inək ələ keçirdilər. Dinin pənahı olan şah Xınıs[2301] ölkəsini basıb yandırdı və Pasinə yollandı. Aləm sakinlərinin şahzadəsi İsmayıl mirzə və Bəhram mirzə Pasində müzəffər orduya birləşdilər.

Həmin vaxt qaravulluğa getmiş Şahqulu sultan, Mahmud xan və Şahverdi bəy Keçəl o tərəfdən (Osmanlı ordu tərəfdən) qaravulluğa gəlmiş iki min nəfərlə döyüşüb, onların bir dəstəsini qətlə yetirərək başlarını aləmin pənahı olan dərgaha gətirdilər. Pirqulu bəy Əfşar "qapı-xalqı"[2302] adamları ilə döyüşüb, onların bir neçəsini alaybəyi[2303] ilə birlikdə tutaraq əşrəfin nəzərləri qarşısına gətirdi.

Sultan Süleyman işi ehtiyatlı tutmaq üçün Üləməni, Ərzurum paşasını və Sivas paşasını yaxşı silahlanmış on üç min süvari ilə Ərzuruma göndərdi, özü isə Mərəş[2304] ölkəsinə hərəkət etdi ki, oradan özünü Diyarbəkrə salsın və çoxlu tüfəngçiləri qicdavul[2305] [təyin] etdi. Elə ki bu xəbər ali [hökmdarın] qulağına çatdı, o həzrət çoxlu ordu ilə onun ardınca sürətlə hərəkət etdi. Zəfər nişanlı məiyyətin gəlişindən öncə onlar Bitlis yolundan keçib özlərini Amidə çatdırdılar. Dinin pənahı olan şah, Əli sultan Tatıoğlunu yaxşı təchiz edilmiş iki min[2306] nizədar süvari ilə Əxlata, Gözəldərəyə və Adilcevaza basqın etməyə göndərdi. Dəniz kimi coşan, ildırım kimi gurlayan ordu Muş ölkəsini elə yandırdı ki[2307], samandan və taxıldan bir əlamət qalmadı.

Bu hadisə baş verərkən İmamqulu xəlifə Çəmişkəzəkli, Sultan Süleymanın yanından gələn bir çavuşu tutub islamın pənahı olan dərgaha gətirdi. O ərz etdi ki, Üləmə Tərcanda oturmuşdur. Tərifli xasiyyətə

---

[2296] İslam rəvayətlərinə görə, Məhəmməd peyğəmbərin merac gecəsi mindiyi adam başlı və at bədənli bir heyvanın adı.
[2297] Məclis nüsxəsi: "min səkkiz yüz nəfəri".
[2298] Aqşəhr – Türkiyədə, Toqatdan şərqdə, Sivasdan şimal-şərqdə, Koyluhisarla Suşehri arasında, Kelkit çayı vadisində yerləşən yaşayış məntəqəsi. İndiki adı Akşardır. Bu Aqşəhri Gürcüstandakı Aqşəhr (Axalkalaki) və Konya yaxınlığında yerləşən Akşehirlə qarışdırmamaq lazımdır.
[2299] Baroda nəşrində səhvən "Kax" yazılmışdır.
[2300] Məclis nüsxəsi: "Osman bəy üç yüz nəfərlə"; Bakı nüsxəsi: "səkkiz yüz nəfərlə".
[2301] Xınıs – Pasin ovalığından cənubda, Ərzurumla Əxlat arasında yerləşən yaşayış məntəqəsidir.
[2302] Bakı nüsxəsi: "qapıqulu".
[2303] Tehran çapında "alaybəyi" əvəzinə yanlışlıqla "əla-yeki", Nuruosmaniyyə nüsxəsində isə "balayi-yeki" yazılmışdır. Bakı nüsxəsi: "bir neçə nəfər alaybəyini tutub".
[2304] Bakı nüsxəsi: "Muş".
[2305] Baroda nəşri: "çağdavul"; Bakı nüsxəsi: "cəndavul".
[2306] Nuruosmaniyyə və Bakı nüsxələri: "on min".
[2307] Baroda nəşri: "Muş ölkəsini elə çalıb-çapdı ki..."

malik padşah o bəd əməlli düşməni məhv etmək üçün hərəkətə keçib, Sənin[2308] yolundan Tərcana irəlilədi. Sürətli yürüş edərək getdi və fələk rəftarlı əsgərlər dəstə-dəstə onun ardınca tələsdilər.

Beyt

“Qoşunun hamısı getdi dəstə-dəstə,
Dəniz kimi coşdu səhra və dağ”.

İki tərəfin dilavərləri bir-biri ilə yumruqlaşmadan öncə Üləmə arxasını çevirdi və iki tərəfin mübarizlərinin bellərindən qılınclarını çəkməsindən əvvəl qalxanını atdı. O, canının qorxusundan Tərcanı buraxıb qaçmağa üz qoydu və qaban kimi eniş-yoxuş bilmədi. Əzəmətli qazilər dəstə-dəstə ittifaq edib sağa və sola on günlük yol getdilər və qarət edib qənimət gətirdilər.

Cahan hökmdarı Tərcandan Ərzincana hərəkət etdi. Aləm sakinlərinin şahzadəsi İsmayıl mirzə yekşənbə günü, həmin ayın 27-də (01.09.1548)[2309] dəniz kimi coşan, ildırım kimi gurlayan, günəş kimi qılınc vuran, balıq kimi cövşən geyən bir ordu ilə qabaqca yola düşdü. Yürüşün səs-küyü və tez gedən atların tozu Keyvan eyvanından keçdi.

Nəzm

“Zəmin gethagetdə elə tələsdi,
Hərçənd axtardı çərxini tapmadı.
Hərb meydanının atlarının yerişindən,
Zəmin dəmir kanı, səma tozu dağ oldu”.

Aləm sakinlərinin şahzadəsi İsmayıl mirzə savaş dəryası nəhənglərindən bir dəstə ilə Bayburd ətrafında Məhəmməd paşa Təkəoğluya[2310] rast gəldi. Sözügedən paşa qaçmağı qənimət bilib fərar etdi və qızılbaşların bir qismi onları təqib edib div kimi rumilərdən dörd yüz əlli nəfəri qətlə yetirdilər. Ərzincan şəhəri zəfər nişanlı padşahın gəlişindən cənnət bağının bir nişanəsinə döndü. Çölün və səhranın səthi çadırlarla və alaçıqlarla doldu. Şəhəri yandırıb və qarət edib o şəhərin torpağını fanilik küləyinə verdilər.

Dinin pənahı olan şah zülqədər qorçularını qaravulluğa göndərdi. Onlar bir məkanda istirahət üçün dayandılar və könül rahatlığı ilə yuxuya getdilər. Sultan Süleymanın yanından gələn Osman paşa Rumi[2311] onları üzərinə basqın etdi. Zülqədərlər qəzəbli şir kimi yerlərindən qalxıb düşmənə qarşı müdafiə olunmaqla və döyüşməklə məşğul oldular. Hər iki tərəfdən [atılan] oxların gəliş-gedişindən o qaranlıq gecədə döyüş meydanının havası şimşəklə doldu və can alan qılıncın dəhşətindən düşmənlərin ürəyi iztiraba düşdü. [Zülqədərlər] rumiləri məğlub etdilər, onlardan otuz nəfəri qətlə yetirdilər, başları və “axtarma”ları[2312] dinin pənahı olan şaha çatdırdılar və [onun qarşısına] qoydular.

O həzrət çaharşənbə günü, ramazan [ayının] 14-də[2313] (17.10.1548) Ərzincan şəhərindən geri dönüb şəvvalın əvvəlində (03.11.1548) səadət və uğurla Üçkilsədə[2314] cah-calallı şəkildə dayandı və aləm sakinlərinin şahzadəsini, Abdulla xanı və Gögcə sultanı Şirvana yolladı.

Elə ki cahanı tutan tuğun ayparası öz gəlişinin şəfəqini Kür çayı kənarına saldı, [şah] Sevindik bəy Qorçubaşını iki min beş yüz qorçu ilə Şəkiyə basqın etməyə göndərdi. Qorçular o diyarı basdılar və qələbə bayraqlarını qaldırdılar. Dərviş Məhəmməd xan qazilərin qorxusundan Kiş qalasına[2315] pənah apardı. O əsnada xəbər çatdı ki, Əlqas İraqa gəlmiş, Bəhram mirzənin ailəsini və köçünü aparmışdır. Buna görə də qorçular zəfər nişanlı orduya qayıtdılar. Aləm sakinlərinin şahzadəsi və Abdulla xan da orduya qoşuldular. Dinin pənahı olan şah köçhaköçlə Tarom və Xalxal yolundan Qəzvinə hərəkət etdi.

[2308] Ellis nüsxəsi: “Sətin”; London nüsxəsi: “Səfin”; Bodleian nüsxəsi: “Səftən”; Nuruosmaniyyə nüsxəsi: “Səin”; Bakı nüsxəsi: “Səbin”. Bu məkanın Muşla Tərcan arasında yerləşdiyi bəlli olur.
[2309] Göstərilən miladi tarix şənbə gününə təsadüf edir.
[2310] Baroda nəşri: “Təkoğlu”; Bakı nüsxəsi: “Bəyoğlu”.
[2311] Nüsxələrdə (həmçinin Bakı nüsxəsində): “Osman Çələbi Rumi”.
[2312] Axtarma – türkcə “axtarmaq” felindən götürülmüşdür və vuruşmadan sonra qalib tərəfin döyüş meydanını axtararaq, öldürülmüş düşmənlərin üzərindən topladığı qəniməti bildirən termindir.
[2313] Baroda nəşrində səhvən “10-da” yazılmışdır. Bakı nüsxəsində günün tarixi yoxdur.
[2314] Üçkilsə – indiki Eçmiədzin şəhəri.
[2315] Kiş qalası – XIV-XVI əsrlərdə indiki Şəki rayonunun Kiş kəndi yaxınlığındakı eyniadlı qala.

Əlqasın İraqa gəlişinin şərhi belədir ki, dinin pənahı olan şahın Ərzincanda dayandığı vaxt Sultan Süleymanın qəlbini tamam qorxu bürüdü və o, Əlqası beş min süvari[2316] ilə Kürdüstan yolundan Həmədana göndərdi. Əlqas o şəhərə gəldikdə, Bəhram mirzənin ailəsini və köçünü ələ keçirib Quma yollandı və həmin şəhəri istila etdi. Daha sonra o, Məhəmməd bəy Əfşarı xəzan mövsümündə yarpaqları və gülüstanın [yaşıl] geyimini alıb aparan, şiddətlə əsən idbar qərb küləyi kimi tamamilə zalım və imansız kimsələrdən ibarət ağır qoşunla həmin qışda, dey ayı əsnasında zülm və təcavüzkarlıq tərzi ilə Reyə basqına gendərdi. Onlar oranı qarət edib Əlqasın uğursuzluq əlamətli ordusuna qayıtdılar. [Əlqas] bir aya yaxın Qum şəhərində qaldıqdan sonra Kaşanı fəth etmək arzusuna düşüb o tərəfə doğru hərəkətə gəldi. O, həmin diyarı da istila etdi. O əsnada onun mülazimləri Ərzincan yürüşündən ayrılan və öz ölkələrinə getməkdə olan şah əmirlərinin adamlarından [bəzilərini] tutub onun yanına gətirdilər. Həmin əsirlər dedilər ki, dinin pənahı olan şah həzrətləri məiyyət və ordu ilə yaxınlığa çatmışdır. Buna görə də [Əlqasın] qəlbinə tamamilə qorxu hakim kəsildi və o, İsfahana yollandı.

Elə ki Əlqas mirzə müqayisəyəgəlməz qoşunlarla xarabalıq törədə-törədə İsfahan ətrafına gəldi, həmin diyarın böyükləri Şah Təqiəddin Məhəmməd və onun qardaşı Mirmiran[2317] o nahiyələrin əhalisini şəhərə gətirib mükəmməl bir tərzdə qala müdafiəsi üçün lazım olan hazırlıqları gördülər.

Əlqas o xəyalda idi ki, onlar döyüşsüz və vuruşsuz darvazaları açsınlar. Halbuki şəhərlilər bu fikirdən çox uzaq idilər və günbəgün bürclərin və divarların istehkamını artırırdılar. Müxaliflər ordusu döyüşə gəldi. İsfahanlılar ölüm ahəngli tüfəng zərbələri ilə o güruhu “Dağlar didilmiş yun kimi olacaqdır”[2318] vəziyyətinə saldılar (darmadağın etdilər). Təxminən bir neçə gün[2319] o rəzillər şəhər ətrafında oturdular. Şah Təqiəddin Məhəmməd, Mirmiran, böyüklər və əyanlar dilavərlik meydanının piyadaları ilə ittifaqda, cah-calal sahibi olan Ulu Tanrının yardımı ilə şəhəri qorudular. O əsnada xəbər yetişdi ki, Bəhram mirzə və İbrahim xan bir dəstə dilavərlə birlikdə hərb təndirini alışdırmaq əzmi ilə Kaşan şəhərinə çatmışlar. Buna görə də Əlqas Farsa yollandı və Yəzdxas qalasını tutub qətliam törətdi. Oradan Şiraza yola düşdü. Bəndi-əmir körpüləri çəkilmiş olduğundan o, mümkün olan ən yaxın və ən yaxşı yolla Ağqalanın (Qəleyi-Sefid)[2320] ətəyinə getdi. O zaman İbrahim xanın qardaşı Cüneyd bəy zülqədərlərin ailəsi və köçləri ilə orada idi. Onlar bürcləri və divarları möhkəmlətdilər və müdafiə olunmağa qərar verdilər. Əlqas orada beş gün qaldı və qalanı tutmağın qeyri-mümkün olduğunu gördükdə köç edib Behbehana[2321] yönəldi. Şulistan və Məməsəni[2322] başçıları təxminən min nəfər cəmləşdirdilər və Cüneyd bəyin yanına adam göndərib [soruşdular] ki, məsləhət nədir? Cüneyd bəy dedi ki, bu gün o qaragün qövmə müqavimət etməyin, sabah biz də hazır olub oraya gələrik və birlikdə nifaq əhlini dəf etməyə gedib igidlik və mərdanəlik göstərərik. [Lakin] onlar səbirsizlik edib iki dəstəyə ayrıldılar. Bir dəstəsi onların (Əlqasın) ordusunun ardınca getdilər və çoxlu dəvələr və mallar ələ keçirdilər. Digər dəstə [isə] hamar zəmində sərfəsiz bir şəkildə özlərini onlara vurdular və o pərişan qövmdən təxminən otuz nəfəri qətlə yetirdilər. Axırda Əlqas yeddi yüz müsəlləh süvari ilə köməyə gəlib onları məğlub etdi və onlardan qırx nəfəri öldürdü. Qalanları fərar etdilər. [Əlqas] daha sonra talana getmiş dəstənin ardınca yollanıb, onları da məğlub edərək öz qənimətlərini [onlardan] aldı. Elə ki [Əlqasgili] Behbehana çatdılar, o diyarın adamları fərar etdilər. Oranı yandırıb zilhiccə ayında (yanvar, 1549) Şüştərə gəldi. Onun əsgərləri darvazaya həmlə etdilər. Əmir Zeynəddin Əli və Əmir Əbdülvəhhab şəhərdən çıxdılar və qılınc yarası ilə o tozanağı yatırdılar. Əlqas yəqin bildi ki, bu iş onun iddiasına uyğun şəkildə sona çatmayacaqdır. Bu səbəbdən Dizful tərəfə getdi və orada da bir iş görə bilməyib Bayat qalası yolundan Bağdad hüduduna getdi.

---

[2316] Bakı nüsxəsi: “beş-altı min süvari”.
[2317] Bakı nüsxəsi: “Şah Təqiəddin Məhəmməd Mirmiran”.
[2318] *Qurani-Kərim, “Qariə” surəsi, 5-ci ayə.*
[2319] Məclis nüsxəsi: “iyirmi gün”.
[2320] Qəleyi-sefid (Ağ qala) – İranın Fars vilayətində, Nevbancandan şimal-şərqdə güclü qala.
[2321] Behbehan – İranın cənub-qərbində, Şirazla Əhvaz (Hüveyzə) arasında şəhər.
[2322] Məməsəni – əsas etibarilə Şulistanda yaşamış və köçəri həyat tərzi keçirmiş tayfa *(Seddon, şərhlər, s.276).*

**Şahqulu sultanın Əli sultan Özbəklə müharibə etməsi və imansız özbəklərin məğlubiyyətə uğraması haqqında söhbət**

Bu il Əli sultan Özbək altı min süvari götürüb, qələbə və yağmaçılıq surətini qara qələmlə və cəhalət mürəkkəbi ilə öz xəyal lövhəsinə qeyd edərək Astarabada basqına gəldi. Şahqulu sultan Ustaclu cövşən deşən dilavərlərdən yeddi yüz nəfərlə qızmış şir kimi Cürcan cəngəlliyindın çıxıb Əli sultana həmlə etdi. Tam təəccüblüdür ki, özbəklər də yerlərində möhkəm dayandılar. Xülasə, o iki igid qoşun intiqam qılınclarını qından sıyırıb baş səpməklə (baş kəsməklə) məşğul oldular. Nəhayət, düşmənlər arxalarını çevirib qaçmağa üz qoydular. Namuslu dilavərlər Günbədi-Qabusa[2323] qədər özbəkləri təqib etdilər, onlardan üç yüz nəfəri qətlə yetirdilər və özbəklərin başlarını dinin pənahı olan şaha göndərdilər. Şahqulu sultanın qasidi Azərbaycanda aləmin pənahı olan şahın ordusuna çatdı və Əli sultanın məğlubiyyətini ərz etdi. O həzrət xeyli sevindi.

**Məhəmməd xan Şərəfəddinoğlunun Qərcistan vilayətinə getməsi, onun Bayram-oğlan Özbəklə müharibə etməsi və özbəklərin məğlubiyyətə uğraması**

Bu il Qərcistan hakimi Bayram-oğlan Özbək qıpçaq əşirətlərindən və yaraqlı özbəklərdən çoxlu adamlar toplayıb həmin qoşunlarla ittifaqda Heratrud vilayətinə gəldi. Qədim zamanlardan Herat hakimlərinə bac verən neçə-neçə oymağı və əşirəti [oradan] köçürüb Qərcistan vilayətinə apardı. Bu xəbər Heratda Məhəmməd xana çatdıqda rəcəb ayının (06.08 – 04.09.1548) əvvəllərində Qərcistan vilayətinə yürüş əzmi ilə Kəhdəstan çəməninə gəldi. Ordunun cəmləşməsindən və döyüşkən bahadırların mükəmməl olmasından sonra məqsədə doğru hərəkətə başladı. Qərcistan vilayətinə daxil olan Ağgünbəd yaylağında onlara (Bayram-oğlanın qoşununa) çatdılar. Bayram-oğlan, Məhəmməd xanın şəxsən özünün qoşunun içində olduğunu bilmədi və ayağını möhkəm saxlayıb piyadalardan və süvarilərdən ibarət çoxlu adamlarla dağların başında döyüş səfi tərtib etdi.

O əsnada xanın çərxçisi olan Hüseyn bəy Mirab özbəklərə həmlə etdi. Bayram-oğlan onu məğlub edib istila bayrağını yüksəltdi. Belə olan halda Məhəmməd xanın oğlu Qazaq bir dəstə igidlə köməyə yetişdi və həmlə etdi. Məhəmməd xan bir dəstə qazi ilə göründü. Bayram-oğlanın ayağı yerdən üzüldü və o, fərar etdi. Təkəlülər onları qovub bir çoxlarını əsir aldılar. Xan cənabları İlahi mədədlə Əşbar qalasına tərəf hərəkət etdi. Bayram-oğlanın yaxınları o qalada idilər. Qalanın ətrafı igidlik şüarlı qazilərin məskəninə çevrildikdə Məhəmməd xana yəqin oldu ki, o qalanı döyüşlə tutmaq müyəssər olmayacaq və o, Herata qayıtdı.

**Qazağın və Veys sultanın Haqnəzər-oğlanla müharibə etməsi və özbəklərin məğlubiyyətə uğraması haqqında söhbət**

Bu il xəbər çatdı ki, Haqnəzər-oğlan adlı-sanlı özbəklərin və hərami oğruların bir dəstəsi ilə Amudərya çayından keçib bu vilayətə doğru hərəkət edirlər. Məhəmməd xan bir dəstə qazi ilə Veys sultanı o zaman Baxərzdə olan Qazaq sultana kömək etməyə yolladı. Onlar bir-birləri ilə görüşüb özbəklərin üzərinə getdilər. Xatun körpüsü ətrafında alçaq özbəklərə və zəbun həramilərə yetişdilər. Haqnəzər-oğlan qazilərin gəlişindən agah olduqda döyüşə və vuruşa hazır oldu. Qazaq tüfəngçiləri döyüş səfinin önündə saxladı və özü [isə süvarilərlə] onların başının üzərindən [atılaraq] döyüşə üz tutdu. [Əvvəlcə] tüfəngçilərin hamısı eyni anda tüfəng atdılar. [Daha sonra] qazilər həmlə etdilər. Haqnəzər-oğlan tab gətirməyib fərar yolunu tutdu. Təkəlülər onları təqib edib, onlardan təxminən doqquz yüz nəfəri qətlə yetirərək Herata qayıtdılar.

**İsgəndər paşanın Xoya gəlməsi və Hacı bəy Dünbülinin öldürülməsi haqqında söhbət**

Bu il Van qalası hakimi İsgəndər paşa, Həsən bəy Mahmudinin təhriki ilə Kürdüstan qoşununu cəmləyib, Xoy qəsəbəsində olan Hacı bəy Dünbülinin üzərinə gəldi. Hacı bəy yardımçı və tərəfdarlarının azlığı ucbatından istehkam daxilinə çəkilib döyüşə başladı. Onun arvadı Həsən bəy Mahmudinin bacısı idi. Axırda [bu qadın] darvazanı öz qardaşının üzünə açdı. Ona görə də İsgəndər paşaya qələbə müyəssər oldu. Hacı bəy

[2323] Günbədi-Qabus – İranın şimalında, Cürcan şəhərindən şimal-şərqdə yerləşən şəhər.

mərdanə səy göstərdikdən sonra qətlə yetirildi. Xoy rəiyyətlərindən də bir çoxları qətlə yetirildilər. İsgəndər paşa Vana qayıtdı.

### Müxtəlif əhvalatlar

Bu il rumilərin yürüşü səbəbindən Təbrizdə taun baş verdi. Camaat arasından çox [adamlar] axirət aləminə üz qoydular.

Bu il dinin pənahı olan şah buyurdu ki, Əlincəq qalasını xarab etsinlər.

Bu il Şahqulu sultan Bəlilan Kürd Səlması qarət etdi.

Bu il Urumi (Urmiya) hakimi Süleyman Çələbi Çepni Kürdüstan əmirləri ilə döyüşüb məğlub oldu və mülazimlərinin əksəri öldürüldü.

### Ölümlər

Şərif Təbrizi[2324] sağlam zehin səfası və dürüst təb zəkası ilə öz zamanının digər şairlərindən seçilirdi. Həmişə könül lövhəsində və yaddaş səhifəsində fəsahət əlamətli beytlər və bəlağət şüarlı şeirlər əks etdirmişdi. Qəsidələri və qəzəllər divanı məşhurdur, dillərdə, ağızlarda əzbərdir. O cümlədən Xoca Qiyasəddin Əli Kəhrəni[2325] həcv etmiş və [bu həcvin] üzrxahlğı üçün bir qəsidə demişdir. [Həmin qəsidənin] mətləsi budur:

Beyt

“Olmadım bir qəlbə məqbul, ah bu qabilsizlikdən,
Bir muradım olmur hasil, ah bu hasilsizlikdən”.

Bu il o, Təbrizdə taun xəstəliyindən axirət aləminə yollandı.

### 956-CI İLDƏ (30.01.1549 – 19.01.1550) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Əlqas Qum və Kaşan şəhərlərinə basqın etdikdən sonra Bağdada getdikdə, xondgar hökm verib onu çağırdı. Əlqas Fars və İraq fitnəkarlarının və aləm məmləkətlərinin kəmfürsətlərinin məsləhəti ilə şəbədəbazlığa və oyunbazlığa başlayıb, işvə və füsunkarlıqla tabeçilik üzünə müxaliflik sipərini çəkdi. Dinin pənahı olan şahın taleyinin qüvvətindən onun bəxt ulduzu sönməyə başladı və onun səadət gündüzü fəlakət axşamına yaxınlaşdı. O, Sultan Süleymanın dərgahına yollanmayıb, Bəhram mirzənin ailəsini və köçünü aləmin pənahı olan dərgaha göndərdi. Buna görə də Sultan Süleyman ikinci vəzir (vəziri-sani) Məhəmməd paşanı otuz min adlı-sanlı süvari ilə onu dəf etməyə göndərdi. Rumilər günorta vaxtı, qələbə bayraqlı günəş səmanın ortasındakı zirvədə olarkən onun üstünə tökülüşdülər. Əlqas “Taqət gətimədiyin şeydən qaçmaq lazımdır” [kəlamında deyildiyi kimi] qaçış kəmərini bağladı və “Məğlubiyyət vaxtı fərar etmək gərəkdir” əlamətinə uyğun olaraq, sərsəm və iztirablı bir halda aradan çıxıb, Sürxab Kürdün hakim olduğu Mərivan qalasına[2326] gəldi. Dinin pənahı olan şah onun Sürxabın yanına gəlməsindən xəbərdar olduqda Bəhram mirzəni, İbrahim xanı və Şahqulu xəlifə Möhürdarı yaxşı cilahlanmış iyirmi min süvari ilə birlikdə o vəfasızın üzərinə göndərdi. Qalibiyyətli qoşun sözügedən qalanın ətrafında ona çatdı və onu məğlub etdi. Əlqas təəssüf və əfsus deyə-deyə Mərivan tərəfə qaçdı. İdbar tozu haqtanımaz Əlqasın rüxsarına qondu. O, həsrət və peşmançılıqla əlini mülkdən və maldan üzdü. Bəlağətli saray münşiləri Sürxaba vəd və təhdiddən ibarət pərvanəçə yazdılar. Buna görə də o, Əlqas mirzəni Bəhram mirzəyə tapşırıb aləmin pənahı olan dərgaha yolladı. O həzrət onu danlayıb dedi:

- Sənə qarşı nə pislik etdim ki, məndən üz döndərib xondgara sığındın?

---

[2324] Ə.Nəvai bu şair haqqında “Azərbaycan qəzəlxanlarından olub, həcv qoşmaqda bacarıq sahibi idi” deyə şərh yazmışdır *(Nəvai, şərhlər, s.1328)*.

[2325] Şah Təhmasib dövrünün müstövfilərindəndir *(Nəvai, şərhlər, s.1328)*.

[2326] Mərivan qalası – İranın Kürdüstan vilayətində, Sinnədən (Sənəndəcdən) 50 mil qərb və şimal-qərb istiqamətində yerləşir *(Seddon, şərhlər, s.280)*.

Əlqas susmağı qərara alıb cavab vermədi. Dinin pənahı olan şah iki gündən sonra onu Qəhqəhə qalasına[2327] göndərdi. Bu əbədi dövlətin xoşbəxtliyi sayəsində onun böyük fitnəsi ən yaxşı şəkildə və ən gözəl surətdə yatırıldı. Bu səbəbdən "yaxşı vəziyyət" ("vəzi-nik") [ifadəsi əbcəd hesabı ilə bu əhvalatın] tarixi oldu.

### Dinin pənahı olan şahın Abdulla xanı Şirvana hakim göndərməsi haqqında söhbət[2328]

Bu il dinin pənahı olan şah, Abdulla xan Ustaclunu Şirvana hakim yolladı. O diyarı istila etmiş Bürhan vəfat etmişdi, şirvanlılar onun cəsədini gizlətmişdilər. Abdulla xan onu tapıb gordan çıxardı və başını bədənindən ayırdı. Şirvan camaatı xanın qorxusundan Qülzüm (Xəzər dənizi) kənarında bir ada olan Derov adlı mövqeyə[2329] pənah apardılar və idbar alınlarına üsyan əsabəsini (bantını) bağladılar. Abdulla xan hərçənd elçilər göndərib nəsihət etsə də, müxaliflər sülhə razı olmadılar. Abdulla xan onları dəf etməyə yollandı. Qızılbaş qoşunları atlarını suya çapıb döyüş atəşini alovlandırdılar. Şirvanlılar [sudan] kənara düşmüş balıq kimi iztiraba düşdülər. Qazilər onların əksəriyyətini qətlə yetirib mallarını qarət etdilər. Ondan sonra xan Şamaxıya yola düşdü.

### İsgəndər paşanın İrəvana gəlməsi və Hüseyncan sultanın qaçması haqqında söhbət

Bu il İsgəndər paşa Kürdüstan qoşununu cəmləşdirib Çuxursəədə gəldi. O zaman həmin diyarın hakimi olan Hüseyncan sultan Rumlu mülazimlərinin pərakəndə halda olması səbəbindən, döyüşməyi məsləhət görmədi. O, öz vəkili olan Təbət ağanı iyirmi nəfərlə[2330] qaravulluğa göndərdi. Onlar İsgəndər paşa ilə vuruşub məğlub oldular. Onlardan beş nəfər qətlə yetirildi. Təbət ağa [Hüseyncan] sultanın ordusuna qayıtdı. İsgəndər paşa İrəvana gəlib o qəsəbənin bazarını yandırdı, daha sonra Van qalasına qayıtdı. Hüseyncan sultan onun ardınca gedib onlardan on nəfəri qətlə yetirdi. Bu xəbər dinin pənahı olan şaha çatdıqda ona kömək etmək üçün Çərəndab sultan Şamlunu Çuxursəədə yolladı.

### Şahverdi sultan Ziyadoğlunun Bargiri qalasını tutması haqqında söhbət

Bu il *dinin pənahı olan şahın əmri ilə*[2331] Şahverdi sultan Ziyadoğlu Naxçıvandan Bargiri qalası üzərinə sürətlə hərəkət etdi. O zaman Süleyman bəy Kürd təcavüzkarlıq xəyalı ilə Sultan Süleyman tərəfindən o qalaya gəlmişdi. Şahverdi sultan dilavərlərdən iki yüz qırx nəfərlə gecə vaxtı qalaya çatdı. Qazilər aşiq peşəli sərgərdanlar kimi, götür-qoy etmədən və fikirləşmədən qalaya tökülüşdülər və qılıncılarını çəkib kürdlərdən və rumilərdən təxminən iki yüz nəfəri yoxluq şəhristanına yolladılar. Süleyman bəyi tutub ulu dərgaha göndərdilər.

### Müxtəlif əhvalatlar

Bu il çaharşənbə gecəsi, məhərrəm ayında (30.01 – 01.03.1549) Qain vilayətinin beş kəndində zəlzələ oldu və kişilərdən, qadınlardan təxminən üç min nəfər divar altında qaldı. Eşidilmişdir ki, o vilayətin qazısı Mövlana Baqi həmin kəndlərin birində yaşayırdı. O, heyət (astronomiya) elmində mahir idi. Bu bəla baş verməzdən əvvəlki gecə o, kənd camaatına elan etdi:

- Fələklərin (planetlərin) yüksəklik dərəcəsinə və ulduzların sıralanmasına əsasən, bu gecə böyük zəlzələ gözlənilir. Məsləhət budur ki, uşaqlarla və arvadlarla birlikdə səhraya gedib orada istirahət edək.

Həmin kəndin camaatı onun sözünü qəbul etmədi. Mövlana öz arvad-uşağını səhraya apardı və gecə yarısınadək qaldı. [Lakin] havanın soyuqluğundan təsirlənib ailəsi ilə öz mənzilinə doğru hərəkət etdi. Elə

[2327] Qəhqəhə qalası – Cənubi Azərbaycanda, Meşkin şəhərindən 70 km. şimalda, dağ başında yerləşən tarixi qala. Hal-hazırda Ərdəbil ostanına daxil olan Meşkin şəhristanının Ərşəq bəxşiliyindəki Yaft dehistanının ərazisinə daxildir (Qəhqəhə qalası haqqında daha ətraflı bax: *S.N.Xiyavi. Xiyav: qomşodeyi-tarix, s.144-167*).

[2328] Məclis nüsxəsi: "Dinin pənahı olan şahın Şirvan hakimliyini Abdulla xana lütf etməsi".

[2329] Məclis nüsxəsi: "Vird adlı mövqeyə". Başqa bir məlumata görə, üsyançılar Bakının cənub sahili qarşısındakı Zirə (Böyük Zirə, Kiçik Zirə və Qum Zirə) adalarında məskən salmışdılar (bax: *S.Aşurbəyli. Şirvanşahlar, s.344*).

[2330] Nuruosmaniyyə nüsxəsi: "iyirmi süvari ilə"; Məclis nüsxəsi: "yüz süvari ilə"; Bakı nüsxəsi: "yüz iyirmi süvari ilə".

[2331] Bakı nüsxəsi (202a).

qədəmini evin içinə qoymuşdu ki, dərhal zəlzələ baş verdi. Mövlana öz arvadı və övladları ilə birlikdə divarın altında həlak oldu.

Bu il Rum padşahı Sultan Süleyman ikinci vəzir (vəziri-sani) Əhməd paşanı qırx min süvari və piyada ilə Gürcüstana göndərdi. Onlar Qurquraya məxsus Davelini tutub öz diyarlarına getdilər.

Bu il dinin pənahı olan şah Qəzvində qışlaq etdi.

### Ölümlər

Bu il dinin pənahı olan şahın qardaşı Bəhram mirzə cümə günü, ramazan ayının 19-da (11.10.1549)[2332] cənnətə tələsdi. Onun meyitini müqəddəs Məşhədə apardılar və orada dəfn etdilər. Həyatının müddəti otuz üç il[2333] idi. Ondan üç oğul yadigar qaldı: Sultan Hüseyn mirzə, Sultan İbrahim mirzə və Bədiüzzaman mirzə. Mövlana Həlaki[2334] Həmədani [onun ölümünə dair əbcəd hesabı ilə] "Heyf əz Bəhram mirzayi-Hüseyni, heyf, heyf" ("Heyif Bəhram mirzə Hüseynidən, heyif, heyif") = 956 tarixini peyda etdi.

## 957-Cİ İLDƏ (20.01.1550 – 08.01.1551) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Özbək xanlarının Herata gəlməsi və Şah Məhəmməd sultanın öldürülməsi[2335]

Bu il Büraq xan və Əbdüllətif sultan böyük qoşunla Amudərya çayından keçib Herata hərəkət etdilər. Onların gəlişi xəbəri Məhəmməd xanın qulağına çatdıqda hökm etdi ki, şəhərin bayırını küçəbənd etsinlər. Bu işlərin sərəncamından və istehkam ləvazimatının tamamlanmasından sonra hər küçəbəndi və yolu şücaətlilərdən və etimadlılardan birinə tapşırdı. Firuzabad darvazasının küçəbəndini Veys sultana həvalə etdi. Xoş darvazasını qorumağa Sincab sultan Əfşarı təyin etdi. Quticaq[2336] darvazasının bayırındakı yolları Qazaq sultanın öhdəsinə verdi. Məlik darvazasının küçəbəndlərində Tatar bəy və Əmir Hüseyn Xətib mühafizə bayrağını qaldırdılar. Məhəmməd xan bir dəstə igidlə Sultan Məhəmməd mirzənin xidmətində qaldı. Pəncşənbə günü, cəmadiyüləvvəl [ayının] 5-də (22.05.1550)[2337] Büraq xan və b. sultanlar Herata gəldilər, bəzi nahiyələrdə və bölükatda düşərgə saldılar. Turan sultanlarının ən cəsuru Şah Məhəmməd sultanı cavanlıq hərarəti bürüdüyündən və igidlik, pəhləvanlıq izhar etmək istəməsi səbəbindən öz adamları ilə Xoş darvazası küçəbəndinin yanına gəldi və orduya döyüş atəşini alovlandırmağı əmr etdi. Sincab sultan Əfşar o sitəmkar zalımı dəf etmək və ona mane olmaq üçün küçəbənddən çıxıb, ürək deşən oxun və can odlayan tüfəngin yarası ilə qaragün özbəkləri gedər-gəlməzə yolladı. Axırda özbək ordusu əfşar camaatına qələbə çalıb onun mülazimlərindən beş nəfəri qətlə yetirdi. Sincab sultan özünü küçəbəndin içinə çatdırdı. Qızılbaş qoşununun topçuları[2338] Şah Məhəmməd sultanı tüfəng atəşi ilə küçəbənddən uzaqlaşdırdılar. Səbatsız sultanların fərarından sonra Herat bölükatında Şah Məhəmməd sultanı adlı-sanlı özbəklərin və harami türklərin əksəriyyəti ilə birlikdə Sistan və Fərah vilayətinə göndərdilər. Həmin vilayətin nahiyələrinə gəldikdən sonra o, malların, əşyaların talanması, acizlərin və fəqirlərin namusunun sındırılması və həyatlarının qırılması haqqında hökm verdi. O bölgəni xaraba qoyduqdan, varlılara və yoxsullara əzab verdikdən sonra o, sultanların ordugahına tərəf qayıtdı. Görüş əsnasında təsadüfən Büraq xana etiraz etdi:

- Mənim [burada] olmadığım müddətdə nə üçün səhlənkarlıq göstərib küçəbəndləri tutmamışsınız? Sabah mən səf yaran igidlərlə birlikdə atlanıb [şəhərə giriş] yollarını qızılbaşlardan almayınca atdan enməyəcəyəm.

Ertəsi gün Şah Məhəmməd sultan özbəklərin çoxsaylı bir dəstəsi ilə həmin iddianı sübut etməkdən ötrü Şahzənd[2339] məzarı yaxınlığındakı küçəbəndə doğru hərəkətə gəldi. Oraya çatdıqda hərb bayrağını qal-

[2332] Qeyd olunan miladi tarix cümə gününə deyil, şənbə gününə təsadüf etmişdir. Məclis nüsxəsində "ramazan [ayının] 10-da" (02.10.1549 – cümə axşamı gününə təsadüf edir) yazılmışdır.
[2333] Məclis nüsxəsində səhvən "otuz il" yazılmışdır.
[2334] Məclis nüsxəsində səhvən "Hilali" yazılmışdır.
[2335] Bakı (202b).
[2336] Məclis nüsxəsi: "Qonucaq"; Bakı nüsxəsi: "Qotucaq".
[2337] Bakı nüsxəsində (202b) tarix yoxdur.
[2338] Bakı nüsxəsi: "qızılbaş topçuları və əsgərləri".
[2339] Seddon nəşrində (II c., s.156) və Bakı nüsxəsində "Şahi-Zində" yazılmışdır.

dırdı. Üç min nəfər igidlə[2340] gözlənilməz bəla kimi o küçəbəndin mühafizlərindən olan Söhrab bəyə basqın etdi. Söhrab bəy müqavimət göstərməyə tab gətirməyib fərar etdi. Şah Məhəmməd sultan onu təqib edib, cəsurluğunun və qorxmazlığının bolluğundan, ehtiyatsızlığının və tələskənliyinin çoxluğundan küçəbəndin ağzına kimi getdi. Geri qayıdarkən başına yekə bir daş dəydi. O çevik cavan yəhər üstündən torpaq üzərinə düşdü. O halda zavalsız Kərimin (Allahın) köməyi ilə Məhəmməd xanın mülazimlərindən biri özünü ona yetirib şərlə dolu başını bədənindən ayırdı.

Beyt

"Şər düşünənin başında da şər olar,
O, evin içindəki əqrəb kimi xain olar".

Və həmin başı xanın yanına gətirdi. Onun köməksiz yoldaşlarından beş-altı nəfəri əsir tutdular. Ona görə də Büraq sultanın ürəyini tamamilə xof bürüdü. Şənbə[2341] günü, həmin ayın 27-də (13.06.1550) o, Herat ətrafından köçüb Buxaranı fəth etmək tamahı ilə yola düşdü. Çünki o diyarın (Buxaranın) valisi Əbdüləziz sultan ibn Übeyd xan vəfat etmişdi.

### Dinin pənahı olan şahın Sevindik bəy Qorçubaşını və Həsən bəy Yüzbaşını Bigə Ərdəlanın üzərinə göndərməsi haqqında söhbət

Bu il Sürxab Kürd dinin pənahı olan şahın dərgahına adam göndərib ərzə çatdırdı ki, Şəhrizur valisi Bigə Ərdəlan[2342] rumilərin bir dəstəsi ilə Sürxabın qalasının ətrafına gəlmişdir. Bu xəbər yelinin əsməsi səbəbindən, dinin pənahı olan şahın qəzəb alovu alışdı və ali fərman verildi ki, Sevindik bəy Qorçubaşı, Həsən bəy Yüzbaşı və Rüstəm bəy Əfşar beş min süvari ilə o mərdimazarı dəf etməyə yollansınlar. Əmirlər göstərişə uyğun surətdə yola düşdülər. Onlar o bölgədə tüğyan edən Tülvar çayından keçdilər və məqsədə doğru sürətlə hərəkət etdilər. Səksən nəfər qorçu Şəhrizur bağlarının kənarında yanında yeddi yüz süvarisi olan və şücaətinin çoxluğu üzündən dastanlardakı Rüstəmi özünün nökəri sayan Bigə ilə döyüşə başladılar və onu nizə yarası ilə atdan aşırdılar. O, yüz hiylə ilə özünü qazilərin əlindən xilas edib qalaya çatdırdı. Onun yaxınlarından qırx nəfər döyüşdə öldürüldü.

Bu sətirlərin müəllifi Həsən bəy Rumlu Zələm qalasından[2343] hündür olan bir təpədə bir dəstə kürdlə vuruşdu. Sayları təxminən əlli nəfər olan rumlu qorçular kürdlərin qarşısından fərar etdilər. Şadi bəy Zülqədəri qətlə yetirmiş bir kürd[2344] Qünqürat sultanın oğlu Şahverdi bəyi əsir tutmaq istədi. Bu fəqirin yoldaşı olan Hüseynqulu Xüləfa hərçənd "ey cavanlar, səy göstərin ki, qadın paltarı geyməyəsiniz"[2345] – deyə hayqırsa da, onları elə vahimə bürümüşdü ki, atlarını qoyub özlərini yüz məşəqqətlə dağdan endirdilər. Bu fəqir, Hüseynqulu Xüləfa ilə birlikdə həmlə edib kürdləri pərən-pərən saldıq və Şahverdi bəyi [ata] mindirib yola düşdük. Qorçuları təqib edən və sayları təxminən qırx nəfər olan kürdlərlə döyüşə-döyüşə aradan çıxdıq.

Sevindik bəy Şəhrizur ətrafında dayandı və Sürxab qaladan çıxıb ona qoşuldu. Qazilər Şəhrizur nahiyələrini çalıb-çapdılar və istila bayrağını yüksəltdilər. Sevindik bəy Qorçubaşı, Rüstəm bəy Əfşarı çoxlu dilavərlərdən ibarət bir dəstə ilə Bigə[2346] vilayətinə basqın etməyə göndərdi. Onlar o vilayəti xaraba qoyub geri döndülər. İyirmi gündən sonra Sevindik bəy Qorçubaşı qayıdıb Qəzvinə gəldi.

Dinin pənahı olan şah Qəzvin qışlağından çıxıb Sultaniyyə yaylağına hərəkət etdi və köçhaköçlə Azərbaycana yola düşdü. O, Məsum bəy Səfəvini, Şahqulu xəlifə Möhürdarı və Əli sultan Təkəlünü Tərgur və Mərgura[2347] basqına göndərdi. Qazilər o diyarı qarət edib imansız kürdlərin çoxunu qılınc və ox zərbəsi ilə həlak torpağına saldılar, atlardan, qatırlardan, inəklərdən və qoyunlardan ibarət çoxlu heyvanlar qənimət götürdülər və Səlmasda asiman bünövrəli orduya qoşuldular. Fələk ehtişamlı məiyyət Urumi [gölü] kənarında

[2340] Bakı və Nuruosmaniyyə nüsxələri: "üç-dörd nəfər igidlə".
[2341] Baroda nəşri: "seşənbə". Həmin miladi tarix təqvimə əsasən cümə gününə təsadüf edir.
[2342] Ərdəlan – İranın qərbində, Kirmanşahdan şimalda yerləşir *(V.F.Minorsky. "Tadhkirat al-Muluk", p.171)*.
[2343] Zələm qalası – İraqın Şəhrizur şəhəri yaxınlığındakı bir təpədə yerləşən qala *(Seddon, şərhlər, s.277)*.
[2344] Bakı nüsxəsində: "bir kürd" əvəzinə "kürdlər".
[2345] Baroda nəşri: "ey cavanlar, ya səy göstərin, ya da qadın paltarı geyinin"; Məclis və Bakı nüsxələri: "ey cavanlar, səy göstərin ki, qadın şalvarı geyməyəsiniz".
[2346] Bakı nüsxəsi: "Kərkük".
[2347] Hər iki yer Şimali İraqdadır. Tərgur (Tərkur) – Cüləmərg yaxınlığında, Mərgur (Mərkur, Mərkəvə) isə Şəhrizur bölgəsindədir *(Seddon, şərhlər, s.277)*.

yerləşən Göyərçinlik qalasına[2348] tərəf hərəkət etdi. Kama yetmiş padşahın dövlətinin nurundan, fələk görkəmli qala aləmi işıqlandıran günəşin doğuşunu qısqandırdı. Qalanın surəti [şahın] parlaq könül aynasına son dərəcə xoş gəldi. O qalanın böyründə bir dağ vardı. Onu da qalaya çevirdilər. Dinin pənahı olan şah Naxçıvana yollandı. Bir ay boyunca oranın hüdudunda qaldıqdan sonra Qarabağa getdi və o diyarda qışlaq etdi.

### Yaka türkmənlərinin yağı olması[2349] və Şahverdi bəy Keçəlin öldürülməsi haqqında söhbət

Bu il yaka türkmənləri yağı oldular. Onların üsyankarlıqlarının səbəbi odur ki, dinin pənahı olan şah, Şahqulu sultandan sonra Astarabad[2350] hakimliyini Şahverdi bəy Keçələ verdi. Yaka-türkmən adamları bol peşkəşlərlə o nadan əmirin yanına gəldilər. [Onların arasında] Aba (Abay) adlı bir cavan vardı ki, oxlu tayfasının sərdarı idi. Onun gözəlliyi və yaraşığı mükəmməl dərəcədə idi. Şahverdi bəy ona eşq elan etdi. O, bu vəziyyətdən təngə gəlib gecə yarısı Astarabaddan fərar etdi və öz ulusunun arasına getdi. [Aba], Şahverdi bəyin əqrəbalarından olan və onun tərəfindən türkmənlərə daruğalıq edən Şatır bəyi qətlə yetirib yağı oldu.

Bu xəbər Şahverdi bəy Keçələ yetişdikdə türkmən ulusu üzərinə basqına getdi. Elə ki həmin hüduda çatdı, beş qulluqçu ilə[2351] bir təpənin başına çıxdı və özünün bütün qoşununu basqına göndərdi. O əsnada Aba Türkmən bir dəstə igidlə Şahverdi bəyə çatıb onu qətlə yetirdi. Onun zorakılıqla məşğul olan mülazimləri bu xəbəri eşidib fərar etdilər. Bu xəbər Damğana yetişdikdə, o diyarın hakimi Əmirqeyb bəy[2352] sürətlə Astarabada gəlib həmin şəhəri mühafizə etdi.

### Bayram-oğlanın öldürülməsi və Qərcistanın fəthi haqqında söhbət

Bu il Qərcistan vilayəti fəth olundu. Həmin [əhvalatın] şərhi belədir ki, Məhəmməd xan, Büraq xandan xatircəm olduqdan sonra iltifat şəfəqlərini Qərcistan qalaları barədə bir tədbir görməyə saldı. O, Qazaq sultanı çoxlu qoşunla Əşbar[2353] qalasını fəth etməyə göndərdi. Çünki Bayram-oğlan bir dəstə özbəklə o qalada idi. Bayram-oğlan qazilərin xofundan qala divarına arxalandı və qızılbaş qoşununun şiddəti özbəklərin cəmiyyətinin əsasını darmadağın etdi. O qorxmaz (Bayram-oğlan) öz xanimanının təhlükəyə düşdüyünü gördü və bu hadisədən [qurtulmaq] üçün nə tədbir görmək lazım olduğu barədə çaşıb qaldı. Peşəsi zəlalət olan o şəxsin (Bayram-oğlanın) düşüncə aynasında heç bir vəchlə yaxşılığa doğru bir surət görünmədi. O, üzrxahlıq etmək üçün Qazağın yanına elçi göndərdi və aman dilədi. Əhd-peyman bağlandıqdan sonra o, öz adamları ilə qaladan çıxıb Qazaqla görüşdü. O qəddar (Qazaq) onu (Bayram-oğlanı) qətlə yetirib Qərcistan vilayətini zəbt etdi.

### Ölümlər

Übeyd xanın oğlu Əbdüləziz sultan bu il Buxarada vəfat etdi. O əsnada Bəlx hakimi Pir Məhəmməd xan sürətli yürüş edib özünü Buxaraya saldı. Pir Məhəmməd xan[2354] o qalanı zəbt etdi. Neçə gündən sonra Büraq xan o şəhəri mühasirə etdi. Pir Məhəmməd xan müdafiə olunmağa və vuruşmağa başladı. Büraq xanın adamları hərçənd səy göstərib mərdliklə döyüşsələr də, bir iş görə bilmədilər. Şəhərin zəbt etməyə aciz qalan Büraq xan o diyarın nahiyələrini yandırıb Daşkəndə yollandı.

---

[2348] Göyərçinlik qalası – Urmiya gölünün şimal-qərb sahilində qala.

[2349] Nuruosmaniyyə və Məclis nüsxələri: "Aba Türkmənin yağı olması"; Bakı nüsxəsi: "Aba Türkmənin yağı olması və Şahverdi bəy Keçəlin onun əli ilə öldürülməsi".

[2350] Nuruosmaniyyə nüsxəsində səhvən "Herat" yazılmışdır.

[2351] Baroda nəşri: "yanında heç kəs olmadan"; Məclis nüsxəsi: "yanında heç qulluqçu olmadan"; Bakı nüsxəsi: "bir neçə mülazimlə".

[2352] Bakı nüsxəsi: "Əmirqeyb sultan".

[2353] Məclis və Bakı nüsxələri: "Əşar". Qazağın sultan olması Bakı nüsxəsinə əsasən yazılıb.

[2354] Tehran çapında səhvən "Büraq xan" yazılmışdır.

## 958-Cİ İLDƏ (1551) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Şəki tərəfə hərəkəti və Dərviş Məhəmməd xanın öldürülməsi

Şəki hakimi Dərviş Məhəmməd xandan dəfələrlə müxaliflik zahir olduğundan, dinin pənahı olan şah çoxlu ordu ilə Şəkiyə yollanıb Ərəş şəhərində cah-calalla dayandı. O əsnada Gürcüstan hakimi Ləvənd bəy itaət və xidmətkarlıq kəmərini belinə bağlayıb fələk şövkətli orduya qoşuldu. Fəth ayətli bayraqlar Şəkiyə tərəf hərəkətə gəldi. Dərviş Məhəmməd xan səadət mahiyyətli bayraqları qarşılamaq mərasimini yerinə yetirməkdən boyun qaçırdı. Dinin pənahı olan şah ona hüsn-rəğbət və hörmət göstərəcəyini vəd edib çağırdı. Lakin o, bədbəxtlik səbəbindən cəhalət üzünü zəlalət çölünə çevirdi və idbar arxasını qalanın möhkəmliyinə söykədi. Buna görə də [şahın] cahanı yandıran qəzəb atəşi alovlandı. O, Bədir xanla Şahqulu sultan Əfşarı[2355] mənqəlay [təyin] etdi. Onlar Dərviş Məhəmməd xanın qaravullarına çatdılar. Onları məğlub edib, Şəki hakiminin işlərinin əsas icraçısı olan Əmir Yusif adlı birisini əsir tutaraq aləmin pənahı olan dərgaha yolladılar. Qiyamət əlamətli əsgərlərin hərəkətindən dənizin və qurunun ətrafına zəlzələ, o bədbəxtlərin məmləkətinə vəlvələ düşdü. Dərviş Məhəmməd xan cahanın pənahı olan padşahın gəlişindən agah olduqda, Cövşən ağanın qardaşı Mahmud bəyi bəd etiqadlı adamlardan ibarət bir dəstə ilə Kiş qalasını mühafizə etməyə qoydu. Özü isə bəzi cahillərlə Gələsən-görəsən qalasına[2356] pənah apardı. Sürətli düşünən müdrikin fikir kəməndi [bu qalanın] fələk misallı bürcünün küngürəsinə çata bilməzdi və kamal sahiblərinin yüksək uçan tərlanı onun uca qəsrinin başında mənzil edə bilməzdi.

Nəzm

“Bir qala aləmdən baş qaldırmışdı,
Yüksək göylərə o, kölgə salmışdı.
Divarının başı fələkdən keçmişdi,
Tamaşasından mələyin gözü mat qalmışdı.
Çəpəri o qədər yüksəkdi ki, uca səmadan alçaq deyildi,
Hündürlüyü o qədərdi ki, qalanın başı görünmürdü.
Fələk kimi binası əlçatmazdı,
Daşürəklilikdə Fərhad dağı idi.
Günəş onun küngürəsinin xəncəri ucbatından hiddətli idi,
Hasarının kölgəsi gündüzün önünə pərdə çəkmişdi.
O şövkətli qalanın üzərindəki tüfənglər,
Dağ üstündə oturmuş əjdahaya bənzəyirdilər”.

Onlar (üsyançılar) həmçinin Elburz dağının arasında bir sığınacaq (“sığnaq”) hazırlamışdılar. Dinin pənahı olan şah [ata] minib qalanı fəth etmək niyyəti ilə yola düşdü. Sevindik bəy Qorçubaşı, Bədir xan Ustaclu və Şahqulu sultan Ustaclu Kiş qalasını əhatəyə aldılar. Şahqulu xəlifə Möhürdar və b. yüksək dərəcəli əmirlər sığnağın yanında mövqe tutdular. Abdulla xan və Gürcüstan hakimi Ləvənd bəy Gələsən-görəsən qalasının yanında məskən saldılar. Şahqulu xəlifə Möhürdar Zülqədər bir dəstə qələbə əlamətli dilavərlə sığnağa həmlə etdi. Müxaliflər onları tüfəng [atəşinə] tutub geri oturtdular. Amma onları (üsyançıları) tamam xof bürümüşdü. Abdulla xan və Ləvənd bəy qələbə şüarlı qoşunun bir dəstəsi ilə Gələsən-görəsən qalasına hücum etdilər. Onlar (üsyançılar) da müdafiə olunmağa başladılar. Lakin qalibiyyətli qoşunların həmləsini müşahidə etdikdə acizlik ucbatından qaçmağa üz qoydular. Fələk nişanlı əsgərlər onların ardınca dəstə-dəstə dağa gəldilər. Elə ki fəth ayətli müzəffər bayraqlar gəlib çataraq öz kölgələrini o Xeybərə bənzər qalaların üzərinə saldılar, dilavərlər irəli gedib “sibə” hazırladılar, badlic, firəngi top və s. qala döyüşü ləvazimatını tərtib etməklə məşğul oldular. Topçular top atmağa başladılar. Peşəsi şücaət olanlar fədakarlıq göstərdilər. Aşağı-

---

[2355] Bakı nüsxəsi: “Şahqulu sultan Ustaclu”.

[2356] Gələsən-Görəsən qalası – Şəki şəhərindən 5-6 km. şimalda, Kiş çayının qərb sahilində, Qaratəpə dağının zirvəsində yerləşmiş orta əsr qalası. XV əsrin əvvəllərində tikildiyi ehtimal olunur (daha ətraflı bax: *M.N.Nəsirli, R.A.Məmmədov. «Gələsən-Görəsən» qalası haqqında // Azərbaycan Tarixi Muzeyinin Əsərləri, VI c., Bakı, 1961*).

dan və yuxarıdan top və tüfəng atıldı. Müxaliflərin bir dəstəsi [Kiş qalasından] çıxaraq əmirlərin mülazimlərindən bir neçə nəfəri qətlə yetirdilər və tam təcili şəkildə geri dönüb qalaya tələsdilər. Qazilər topu yuxarı çəkib aparmışdılar və "Üzərinə odda bişmiş (bir-birinə bitişik) bərk daşlar yağdırdıq"[2357] [ayəsinin] zərurətinə uyğun olaraq, o asimana bənzər qalanın başında dağ görkəmli qazanlar[2358] və top daşları (mərmiləri) zahir olurdu. İyirmi gün sonra firəngi topun və badlicin daşının zərbəsindən [qalanın] bürcü və divarı dağıldı. Həsən bəy Pinəkoğlu[2359] təxminən min tüfəngçi ilə qaladan hündür bir yamaca çıxıb müxalifləri tüfəng [atəşinə] tutdu. Hansı yerdən ki bir barmaq qədərincə bürcdən bir şey baş qaldırsaydı, yüz tüfəng gülləsi bir-birinin ardınca ona dəyirdi. Bir tərəfdən də bürcün altından lağım atırdılar. Bürcə od vurmazdan öncə bürc aşdı və qala əhlinin başına dəhşət və heyrət tüstüsü vurdu. Mahmud bəy zəiflik və biçarəlik meydanında peşmançılıq topu ilə oynamağa başladı, məcburiyyət üzündən təvazökarlıq etməyə gəldi, üzrxahlığı və ahu-zarı nicat vəsiləsi və xilas səbəbi bildi və acizanə bir dillə dedi:

Beyt

"Fəryad etdi tənbur kimi mizrab altında,
Əridi qalay kimi kömür altında".

Qala kutvalı Mahmud bəy qaladan çıxıb büsatı öpmək səadəti ilə baş ucalığı tapdı və qala qapılarının açarlarını dinin pənahı olan şahın vəkillərinə təslim etdi.

Beyt

"Qala qapısı açıldı zəhmətsiz,
Ofsunla çıxdı əjdaha xəzinədən".

O həzrət son dərəcə hüsn-rəğbətlə onun günahından keçdi. Heç bir xoşbəxtin iqtidar qartalı heç bir zaman bu qalanı zəbt etmək havası ilə pərvaza gəlməsə də, qüdrətli dövlətin gücü ilə o adlı-sanlı qala qısa zaman ərzində zor və güc yolu ilə ələ keçirildi. Ali mənşəli padşahın göstərişinə əsasən, zəfər şüarlı ordu o qalanın bürcünü və divarını yerlə yeksan etdi. Dinin pənahı olan şah [ata] minib səadətli üzünü sığnaq tərəfə çevirdi. O həzrətin qoşununun heybətindən müxaliflərin zəhri suya düşdü. Sığnaq adamları Kiş qalasının fəthindən xəbərdar olduqda dəstə-dəstə (çox-çox) aləmin pənahı olan dərgaha gəldilər, acizlik və üzrxahlıq üzünü torpağa qoydular. Dərviş Məhəmməd xan bu halı gördükdə iztiraba düşdü. Dəhşət və qorxusunun çoxluğu ucbatından bir gecə qaladan çıxdı.

Beyt

"Nə dürüst əzmi vardı, nə doğru fikri vardı,
Qorxu ilə dolu ürəyi vardı, tələskənliklə dolu başı vardı".

O, heyrətinin çoxluğu üzündən bilmirdi ki haraya getsin. Abdulla xanla Ləvənd bəyin ordusunun ətrafından keçdiyi əsnada Çərəndab sultan Şamlunun kiçik mülazimi olan Kosa Pirqulu onu öldürüb başını səltənət taxtının ətəyinə gətirdi. Qaladan onunla birlikdə fərar etmiş dörd yüz nəfərdən iki yüz əlli nəfər qətlə yetirildi. Dinin pənahı olan şah bütün Şəki vilayətini ələ keçirdi. [Şahın] ali adının və ləqbinin şərəfinə [orada] sikkə vuruldu və xütbə oxundu.

Beyt

"Qızılın üzərinə şahın adına sikkə vurulduğu üçün,
Qızıl onun adından əlavə bir zinət tapdı".

O diyarın idarəçiliyi Toyqun bəy Qacara[2360] həvalə edildi. O zaman Kiş qalasının kutvalı Mahmud bəy yersiz vahiməyə düşüb hökmdarın ordusundan fərar etdi.

---

[2357] *Qurani-Kərim, "Hud" surəsi, 82-ci ayə.*
[2358] Yəqin ki, burada "qazan" kəlməsi qaynar top mərmirlərini və ya alovlu mancanaq daşlarını ifadə etmək üçün işlədilmişdir.
[2359] Bakı nüsxəsi: "Pələngoğlu".
[2360] Məclis nüsxəsi: "Toyqun sultan Qacar".

**Dinin pənahı olan şahın üçüncü dəfə Gürcüstana qoşun çəkməsi və imansız üsyankarların qırılıb-biçilməsi haqqında söhbət**

Fələk şövkətli ordu Şəkidə olan zaman Qurqura oğlu Keyxosrov[2361] bir neçə nəfər aznavuru aləmin pənahı olan dərgaha göndərdi və yardım istədi. Çünki Vaxuş[2362] Gürcü və Levasan Şermazanoğlu onun ölkəsinin bəzi yerlərini tutmuşdular[2363].

O əsnada xəbər yetişdi ki, İsgəndər paşa Gürcüstana gələrək Ərdanuç qalasını[2364] mühasirə edib. Buna görə də dinin pənahı olan şah məiyyət və ordu ilə yaramaz kafirlərə və ruzigarın qara məlunları olan gürcülərə qarşı cihad etmək məqsədi ilə "Ya Peyğəmbər! Kafirlərə və münafiqlərə qarşı vuruş! Onlarla sərt davran!"[2365] məzmununun zərurətinə uyğun surətdə fələk qübbəsinin tağına hay-küy və vəlvələ salaraq Şəki vilayətindən sürətlə yürüşə başladı. Zəfər şüarlı qazilər pozğun kafir diyarının alçaq və yüksək zəminini əhatə etdilər və o azğın güruhun qaçış yeri olan hər dağ və yamac dilavərlərin tapdağı ilə səhra ilə yeksan oldu. O müşriklərdən heç bir canlı "Allahın kafirləri mühasirəyə saldığı"[2366] qəhr və kin dairəsindən salamatlıqla can qurtara bilmədi. Şəriətin irsinə əsasən, öldürülənlərin arvad-uşaqları, malları və əşyaları öldürənlərin ixtiyarına keçdi. Hər biri öz rüxsarının xalı kimi ruzigarın üzündə yeganə olan gürcü soylu gözəllər və insandan doğulmuş pəri görkəmlilər öz ay üzlülərinin zülfünə əsir olan pərişan aşiqlərin ürəkləri kimi gecə-gündüz hadisələrinin həmləsindən itaət və inayət altına keçdilər. Bir dəstə [gürcü] yüksək dağlara və möhkəm kahalara pənah apardı. Bəziləri Malənkubi-Varqər[2367] qalasına, Derzabad[2368] qalasına və Tanrının yaratdığı qəribə şeylərdən olan kilsəyə sığındılar. İslam qoşunu şücaətlə onları qırıb-biçməyə başladı. İti qılınc və atəş yağdıran nizə yarası ilə neçə min külbaş kafiri "Əlbəttə, münafiqlərin yeri cəhənnəmin ən aşağı təbəqəsindədir"[2369] [ayəsinin] zərurətinə uyğun olaraq, cəhənnəmə və yoxluq diyarına göndərdilər. Tümük qalası neçə digər qalalarla birlikdə zəbt edildi. Gavurlar Tümük dərəsindəki hündür yerlərə və mağaralara getmişdilər. Süvarilərdən və piyadalardan [ibarət] bir dəstə, riyaziyyatçı alimlərin doğru xəyalı kimi, o fələk misallı dağın zirvəsinə dırmandılar. Onlar qarət və tarac etmək üçün kahaların və mağaraların girişlərində izdiham yaratdılar. Necə ki, arı ordusu şirin arı şanı üzərində izdiham edər. Onlar mənimsəmə və qarət əlini mağaralardakı xəzinələrə uzatdılar. Nütfənin bətndə gizləndiyi kimi, əsirlik qorxusundan mağaraların qıraq-bucağında gizlənmiş dəstə-dəstə pəri simalı qulamların bəziləri susuzluqdan cana doyub aşağı endilər.

O əsnada bəzi xəbərçilər dinin pənahı olan şahın ərzinə çatdırdılar ki, Derzabad qalasında və kilsədə olan gürcü aznavurlarından ibarət çoxsaylı bir dəstə gəlib-gedənə basqın edirlər. Buna görə də ali əmr verildi ki, Bədir xan Ustaclu, Şahverdi sultan Ziyadoğlu və Əli sultan Təkəlü o asiman əsaslı qalaya yollansınlar. Adlı-sanlı əmirlər o qalanı mərkəz kimi araya aldılar. Sözügedən qala Tümük dərəsində, Kür çayına axan bir çayın yanında, xalis qayadan ibarət dağın yamacının başında yerləşirdi. Möhkəmlikdə İsgəndər səddi və Xeybər qalası ilə bərabərlikdən dəm vururdu, yüksəklikdə yaşıl günbəzə (asimana) tay olmaq iddiası edirdi.

Nəzm

"Bir qaladır ki, olduqca möhkəmdir,
Aləmdə heç bir adam bənzərini görməmişdir.

---

2361 Qurquranın oğlu Keyxosrov – 1545-1573-cü illərdə Mesxi hökmdarı olmuş II Keyxosrov.

2362 Bakı nüsxəsi: "Vaxuşti".

2363 Vaxuş – Gürcüstanın Mesxi vilayətinin Diyamidze zadəgan nəslindən idi *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi, s.544)*. Şermazan isə Lori bölgəsinin knyazlarından olmuşdur. Bu iki şəxs Samtsxe-Saatabaqo (Mesxi) hökmdarı II Keyxosrovun vassalı olsalar da, onun Səfəvilərə itaət göstərməsini qəbul etməmiş və Kartli çarı Luarsabla ittifaqa girərək Keyxosrova qarşı qiyam qaldırmışdılar *(К.Н.Мелитаури. Строительство и архитектура Вардзии. Тбилиси, 1975, с.55-56)*.

2364 Ərdanuç (Ardanuç) qalası – indiki Türkiyənin şimal-şərq tərəfində, Artvin şəhərindən cənub-şərqə doğru, Çorox çayının sağsahil vadisində yerləşirdi. Bu yerin adı Tehran çapında yanlış olaraq "Ərnavdec", Baroda nəşrində "Ərvanuh", Məclis nüsxəsində isə "Ərtaduc" yazılmışdır.

2365 *Qurani-Kərim, "Tövbə", 73-cü ayə.*

2366 *Qurani-Kərim, "Bəqərə" surəsi, 19-cu ayə.*

2367 Məclis nüsxəsi: "Mankubi-Darfər"; Bakı nüsxəsi: "Malkərbi-Davər".

2368 Bakı nüsxəsi: "Ərzbad". Əslində isə bu sonuncu qalanın adı gürcü mənbələrində Vardzia qalası deyə qeyd olunmuşdur *(П.Горгиджанидзе. История Грузии, с.31-32)*. Vardzia qalası orta əsr abidəsi olub, Gürcüstanın Cavaxeti bölgəsində, Kürün sol sahilində, qayalıq kompleksindəki mağaralar şəbəkəsi əsasında yaradılmış istehkamdardan və monastırdan ibarətdir (daha ətraflı bax: *К.Н.Мелитаури. Строительство и архитектура Вардзии. Тбилиси, 1975*).

2369 *Qurani-Kərim, "Nisa" surəsi, 145-ci ayə.*

Ucalıqda uca göyə oxşayır,
Yer əhli ona fələyə baxan kimi baxır.
İki yüz qərinə əgər uçan qartal uçarsa,
Zənn etmə ki, onun bürcünə yol tapar.
Quş onun zirvəsinə uça-uça qocalar,
Və oraya çatmadan, yenidən yerə düşər".

Sözügedən qalanın ortasında on gəz enliyində dağın içini kəsib dörd geniş xanədən (otaqdan) və uzun süffədən (platformadan) ibarət kilsə [düzəltmişdilər]. Onun bayır və içəri divarlarına qızılla, laciverdlə, bütlərlə, sənəmlərin təsviri və şəkilləri ilə naxış vurmuşdular. İkinci xanənin ortasında bir taxt tərtib edib [üzərinə] qızıldan bir büt qoymuş, onu bahalı cavahirlə bəzəmiş və o cansız heykələ göz yerinə iki parlaq ləl taxmışdılar. Həmçinin sözügedən kilsənin içində, sözügedən xanələr səmtindən yuxarı tərəfə bərk daşdan kəsilmiş təxminən yüz əlli zər uzunluğunda, son dərəcə dar və ensiz bir yol gedirdi. [Bundan başqa], zəmanə hadisələri və dövrün qarışıqlıqları mülahizəsi ilə [orada] iki köşk tərtib etmişdilər. Xanələrin bayır girişlərinə dəmir və polad qapı qoymuşdular.

Beyt

"Oturtmuşlar oraya polad bir qapı,
Bərklikdə xəsisin ürəyi ilə bərabərdir".

İçəri xanədə bir qızıl qapı tərtib etmişdilər. Xülasə, müzəffər qazilər və Bəhram [kimi] intiqamçı dilavərlər yürüş etdilər.

Nəzm

"Əldə qalxan tutub önə qaçdılar,
Hər tərəfdən hərb qapısını açdılar.
Ordunun oxundan qala dəlmə-deşik oldu,
Necə ki, ulduzlardan bu mavi bargah (səma) [deşilib].
O qalanın əhli tüfəng gülləsindən zar və zəlil oldu,
Necə ki, əshabi-fil rəzil olmuşdu"[2370].

Bunu görən gavurlar sərsəm və heyran oldular. Qızmış şirin həmləsini görən ov heyvanı kimi quruyub yerlərində qaldılar. Qələbə şüarlı qoşunlar Pərvərdigarın köməyi ilə hasarın yuxarısına çıxdılar. Onlar islam dininin qeyrət silahını və cihad qılıncını [İlahi] yardımın itiləmə daşı ilə itiləyib gavurların başlarından həyat dərisini soydular. Onların arvadlarını və uşaqlarını əsir etdilər. Dinin pənahı olan şah ali məqamlı əmirlərlə kilsəyə yollandı və ona tamaşa etdi. Bədkirdar və eybəcər keşişlərdən iyirmi nəfəri gedər-gəlməzə göndərdilər. Yetmiş batman həftcuşdan tökülmüş bir zəngi onların həyat şüşəsi kimi sındırdılar. Dəmir və qızıl qapıları qoparıb dövlət xəzinəsinə ("xəzaneyi-amirə") göndərdilər. Dörd şam vardı ki, yaramaz gavurlar onların hər birini altmış batman mumdan tökmüşdülər və onların şəfəqindən öz varlıq xırmanlarını yandırmışdılar. Bədir xan Ustaclu bu şamları qırdı. Dinin pənahı olan şahın ixtiyarına çoxlu mallar və saysız əşyalar keçdi. O cümlədən həmin heykəlin iki gözünün yerinə oturtduqları iki ləl [şahın ixtiyarına keçdi]. Bunların hər birinin əlli tümən məbləğində qiyməti vardı[2371]. Qalanı yerlə yeksan etdilər.

Gürcüstan hakimləri başqa bir yerə gedə bilmədiklərindən, zərurət səbəbindən itaət üzünü aləmin pənahı olan dərgaha [tutub] gəldilər. İlk öncə Aman bəy Gürcü, Ləvasan Şermazanoğlu və Vaxuş bəy bir-birinin ardınca səltənətin məskən tutduğu astanaya gəldilər. O həzrət iltifat kölgəsini o məmləkətin fəthi üzərinə saldı. Bu əsnada Qurqura oğlu Keyxosrov çoxlu peşkəşlərlə ulu dərgaha gəldi. Dinin pənahı olan şah Tümük qalası hakimliyini və Aqşəhri ətrafı və yan-yörəsi ilə birlkdə ona şəfqət etdi. O diyarın hakimi olan Vaxuş Gürcü və Şermazanoğlu qətlə yetirildilər.

Elə ki əzəmətli günəş Tərəzi bürcü üzərinə kölgə saldı, tir ayının ordusu ay səhnəsində fəaliyyətə başladı, ağacların başları aşiqlərin üzü kimi zərnigar oldu, bağ və bostan reyhanları kəhrəba rənginə döndü

[2370] "Əshabi-fil" ("fil sahibləri") – miladi 570-ci ildə, Məhəmməd peyğəmbərin anadan olmasından iki ay öncə Yəmən hakimlərindən olan Əbrəhə əl-Əşrəm müqəddəs Kəbə evini dağıtmaq üçün tərkibində 12 fil olan qoşunu ilə Məkkəyə hücum etmiş, lakin uğursuzluğa düçar olmuşdu. Burada həmin hadisəyə işarə edilir.

[2371] Nuruosmaniyyə və Məclis nüsxələri: "Onların qiyməti əlli tümən məbləğində idi".

və isti havalar mötədil havalarla əvəzləndi[2372], hökmdar öz hərəkət yüyənini Ləvasan[2373] ibn Davudun vilayətinə doğru çevirdi. Zəfər şüarlı ordu Barateli[2374] vilayətinin ətrafını basıb islam bayraqlarını qaldırdı və mallardan, kölələrdən, mal-qaradan və s. ibarət çoxlu qənimətlər qazilərin nəsibi oldu. Fələk şövkətli ordu köç-haköçlə Qarabağa yollandı və o diyarda qışlaq etdi.

Nəzm

“Qarabağın nöqsansız taxtı,
Misri bez[2375] ilə bəzək tapdı.
Cahan çadır cahanında bərpa oldu,
[Bu çadırlar] səadət sübhü kimi fələyi bürüdü.
Hər səmtdən bir ərş baş qaldırıb,
Uca göylərə kölgə salıb”.

**Müxtəlif əhvalatlar**

Bu il Firəngdəki Portuqal padşahının elçiləri Hörmüz yolundan gəlib, dünyanın pənahı olan dərgaha çoxlu töhfələr gətirdilər və neçə gündən sonra mürəxxəs olub (rüxsət alıb) geri qayıtdılar[2376].

Həmçinin bu il Din Məhəmməd Özbək özünün adlı-sanlı bahadırlarından biri olan Qul Məhəmməd Bahadırı ərşə bənzər dərgaha göndərdi. Onu [burada] uzun müddət saxladılar. Axırda mürəxxəs oldu (rüxsət alıb getdi).

Bu il içində ulu dərgahda vəzarət mənsəbinə malik Xoca Əmir bəy Keçəçi həbs edildi. Adı çəkilən şəxs illərlə Qazi xan Təkəlünün vəziri olmuşdu və buna görə də onun törətdiyi bəzi əməllər dinin pənahı olan şahın xoşuna gəlməmişdi. O, hökmdarın danlaq və məzəmmət hədəfinə çevrilərək dustaq edilmiş və uzun müddət həbsdə qalmışdı. Ondan sonra həbsdən buraxıldı və qərar verildi ki, Kirman qalasında sakin olsun. Daha sonra Əmir sultan Rumlunun vəziri oldu. Axırda İmam Rzanın ərş mərtəbəli astanasının touliyyəti ona tapşırıldı. Həmin əyyamda o, ədəbdən kənar olan bəzi hərəkətlər etdi. Bu səbəbdən o, həmin səadətdən məhrum edildi və onun yerini Bəhram mirzənin sabiq vəziri Xoca İnayətullaya verdilər. Müqəddəs Məşhəddən savayı bütün Xorasan məmləkətinin vəzirliyi ona (Xoca Əmir bəyə) həvalə edildi. Dörd il həmin işlə məşğul oldu. Onun əməllərindən zülm və insafsızlıq ortaya çıxdığı üçün, etdiyi zülmün aqibətinin zərurətinə uyğun olaraq, bunların nəticəsində vəziyyəti daha da çətinləşdi. Dinin pənahı olan şah ona qarşı tədbir görmək fikrinə düşdü. Elə bu zaman cah-calallı [şahın] qulağına çatdı ki, adı çəkilən şəxs (Xoca Əmir bəy) dinin pənahı olan şahı özünə tabe etmək məqsədi ilə ulduzların, xüsusən də aləm sultanlarına mənsub olan əzəmətli günəşin təsxiri (tutulması) ilə məşğul olur. Bəziləri onun sarı buzovu[2377] uca səthdə bəsləmək, onu günəşin qarşısında saxlamaq, özünü zəfərana boyamaq, zəfəran rəngində libas geyinmək və üzünü günəşə tutub bəzi dualar oxumaq kimi əməllərini müşahidə etmişdilər. Xülasə, bu əhvalatı behişt ayinli məclisdə danışdılar. Ona görə də qəzavü-qədər kimi cərəyan edən fərman verildi ki, onu bir sənduqənin içinə qoysunlar və o sənduqədə bir deşik açaraq əllərini o deşikdən çıxarıb bağlasınlar. Çünki onun sehrli qüvvəsinin bir qismi barmaqlarının düyünlərində mövcud idi və ondan ötrü belə etdilər ki, o, bu vəziyyətdə həmin sehri əmələ gətirə bilməsin. Axırda onu Qəhqəhə qalasında həbs etdilər və neçə ildən sonra Ələmut qalasına[2378] köçürdülər. Hicri tarixinin 980-ci (1572-73) ilə[2379] çatdığı indiki halda Ələmutda həyatını sürdürməkdədir.

---

[2372] Ç.N.Seddon bunu payız fəsli kimi tərcümə etmişdir *(Baroda nəşri, II c., s.160).* Əslində tir ayı İran günəş təqvimində yay fəslinin ilk ayıdır. Lakin köhnə təqvimlərdə tir başqa mənalarda da işlədilmişdir. Əsədi Tusinin “Fars lüğəti” əsərində tir sözünün 7 mənası verilmişdir ki, bunlardan biri də payız fəslidir (daha ətraflı bax: *Ə.R.Cəmkərani. “Be mahi-tir kangəh bud nisan”: Bərrəsi və nəqdi-beyti əz Xaqani dər şüruhi-müxtəlif // Peyami-Bəharistan, VI / 22, Zemestani-1392, s.11-33*). Burada da məhz payız mənasında işlədilmişdir.

[2373] Bakı nüsxəsi: “Lursab”. Luarsab – 1534-1558-ci illərdə Kartli çarı olmuşdur.

[2374] Barateli – Tiflis şəhərindən qərbdə, Alget çayının mənbələrində yerləşən bu vilayətin adı Osmanlı qaynaqlarında “Barateli”, gürcücə “Sa-Baratiano” adlanır.

[2375] Misri bez (Misir bezi) – Şah Təhmasibin çadırı nəzərdə tutulur.

[2376] Bu elçilik Portuqaliya kralı III Juan (1502-1557) tərəfindən göndərilmişdi.

[2377] Buzov (gusale) – həm də zodiak bürcüdür.

[2378] Ələmut – Qəzvindən şimal-şərqdə, Qəzvinlə Xəzər dənizi arasında güclü bir qala.

[2379] Məclis nüsxəsi: “983-cü ilə” (1575-76); Bakı nüsxəsi: “985-ci ilə” (1577-78).

## 959-CU İLDƏ (29.12.1551 – 17.12.1552) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Rum diyarına getməsi, o hüdudun və ölkənin xarab olması

Rum padşahı Sultan Süleyman tərəfindən Ərzurum hakimi olan İsgəndər paşa Xoyda Hacı bəy Dünbülini qətlə yetirmiş, Çuxursəədə gəlib o şəhərin (İrəvanın) bazarını yandırmış, heç kəs onunla döyüşmədən öz diyarına üz tutmuşdu. Həmin səbəbdən, bu işləri etdiyinə görə lovğalıq və qürur buxarı onun beyninə vurmuş, adlı-sanlı əmirlərə həddini aşan bir neçə məktub yazmışdı. Ona görə də padşahın qəzəb şöləsi alışdı. Hökmdar fərman verdi ki, cahan qoşunları fəth və zəfər günəşinin doğduğu yer olan fəth ayətli bayraqların kölgəsində hazır olsunlar. Qəzavü-qədər kimi cərəyan edən fərmana əsasən, aləmin pənahı olan dərgaha elə bir ordu cəmləşdi ki, onların atlarının tozundan fələklərin lətif aynası torpağın kəsif səthi kimi qaranlıq oldu və göz bəbəyi o ordunun qaraltısından bulandı. [Ordunun sayı] səyyarələr xosrovunun (günəşin) nur bəxş edən zərrələrindən daha ziyadə və asimanın geniş üzündəki ulduzların ədədindən daha çox idi.

Beytlər

“Qarışqalar və çəyirtkələr qədər saysız bir ordu,
Döyüşçü igidlər və bacarıqlı ərlər,
Dilavər pəhləvanlar ki, savaş meydanında,
Nizə ilə qoparırlar göydən ayı”.

O həzrət (Şah Təhmasib) fərman verdi ki, qələbə şüarlı əsgərlər dörd dəstədə, hərəsi bir yolla sürətlə yürüşə çıxsınlar. O cümlədən Məsum bəy Səfəvi, Allahqulu bəy Ayçəkoğlu, Əli sultan Təkəlü, Şərəfəddin xan Kürdün oğlu Şəmsəddin xan, Xəlifə Ənsar, Həmzə bəy Talış, Uluğxan bəy Səədlü və digər əmirlər Ərciş və Bargiriyə hərəkət etsinlər; Şahverdi sultan Ziyadoğlu və Ədhəm bəy Rumlu Pasin səmtinə yollansınlar; o zaman Farsda olan [əmirlərdən] İbrahim xan Zülqədər, Şahqulu sultan Əfşar və Çıraq sultan İraqi-Ərəb vilayətinə basqına getsinlər; Bayram bəy Qacar, Toyqun bəy Qacar və Gürcüstan valisi Keyxosrov Davelinin fəthinə və o nahiyələrin qırılıb-biçilməsinə təyin edildilər. Ali əmrə müvafiq olaraq, adlı-sanlı əmirlər hərəkətə keçdilər. Hər dəstə işarə edilən səmtə doğru yubanmadan yola düşdü. Məsum bəy on min[2380] süvari ilə çaharşənbə günü, şaban [ayının] 17-də (08.08.1552) Ağmeyğan[2381] yaylağından yola çıxdı və onlar da dörd güruh olub yürüşə başladılar.

Məsum bəy, Əli sultan Təkəlü ilə ittifaqda Ərcişə hərəkət etdi; Şəmsəddin xan Muş səhrasına və Əxlata irəlilədi; Qayıtmış sultan Xınıslu və Allahqulu bəy Ayçəkoğlu igidlik meydanının adlı-sanlılarından [ibarət] bir dəstə ilə hərəkət bayrağını Adilcevaz tərəfə qaldırdı; Həmzə sultan Talış və Xəlifə Ənsar çoxlu qazilərlə Bargiri və Bəndmahi tərəfə yönəldilər. Məsum bəy Ərcişə çatdıqda, xondgarın tərəfindən o diyarın valisi və ixtiyar sahibi olan Qara Piri cəsarət üzünü döyüş və vuruş meydanına çevirib qaladan çıxdı. O tərəfdən Məsum bəy, Əli sultanı bir dəstə dilavərlə onu dəf etməyə göndərdi. Hər iki tərəf bir-birinə həmlə etdi. Əli sultan onun boğazına nizə vurdu. Rumilər güc gəlib Əli sultanı geri oturtdular. O əsnada Uluğxan bəy Səədlü[2382] o mərəkəyə çatıb onları məğlub etdi və o bədbəxt qövmdən təxminən otuz nəfəri qətlə yetirdilər. Qara Piri yaralı halda özünü qalaya saldı. Elə həmin gün Xəlifə Ənsar və Həmzə bəy Talış xondgarın mötəbər əmirlərindən olan Məhəmməd bəylə və Xürrəm ağa ilə vuruşdular. Xürrəm ağanı və Məhəmməd bəyi əsir edib, o mənfur qövmdən təqribən yüz altmış nəfəri gedər-gəlməzə göndərdilər. Cümə günü, həmin ayın 27-də (18.08.1552) Ələşkərdin Didəm mövqeyində onları (əsirləri) başlarla və “axtarma”larla aləmin pənahı olan dərgaha gətirdilər.

Şəmsəddin xan Əxlata çatdıqda, orada olan təxminən yüz nəfər rumini qətlə yetirib, təqribən otuz min qoyun, on min inək və camış, üç min at ələ keçirdi və o diyarı yandıraraq[2383] əzəmətli orduya yollandı. Elə ki Qayıtmış sultan və Allahqulu sultan şücaətlilərin bir dəstəsi ilə düşmən diyarına çatdılar, Rum süvariləri Adilcevaz qalasından çıxıb döyüşə və vuruşa başladılar. Qalibiyyətli ordu o məğrur güruhu məğlub edib

---

[2380] Bodleian nüsxəsi: “iki min”.

[2381] Baroda nəşri: “Ağmənğan”; Bakı nüsxəsi: “Ağmuğan”. F.Kırzıoğlu *(Osmanlıların Kafkas ellerini fethi, s.452)* bu toponimi Akmanqan kimi oxumuş və onun Göyçə gölünün qərbində yerləşdiyini bildirmişdir.

[2382] Bakı nüsxəsi: “Ulubəy sultan Səədlü”.

[2383] Baroda nəşri: “çalıb-çaparaq”.

onlardan təxminən yüz nəfəri qətlə yetirdi. O əsnada İbrahim xan Bəxti xondgarın dərgahına gedirdi və qazilərə rast gəldi. Cövşən geymiş dilavərlər o mənfur qövmdən altmış nəfəri gedər-gəlməzə göndərdilər. Onların əlinə iki xərvar qızıl, bir xərvar nəfis gümüş[2384], bir neçə gümüş piyalə və sürahi keçdi.

Şahverdi sultan Ziyadoğlu və Ədhəm bəy Rumlu Pasin və Avnikə basqına getmişdilər. Onlarla oranın hakimi Murad bəy arasında döyüş oldu. Qazilər onu (Murad bəyi) atdan aşırıb onun mülazimlərindən bir çoxlarını qətlə yetirdilər. Murad bəy min cür zəhmətlə özünü qalaya saldı. Adlı-sanlı əmirlər o diyarı yandırıb fələk şövkətli orduya qoşuldular. Dinin pənahı olan şah, əmirləri düşmənlərin vilayəti üzərinə göndərdikdən sonra hərəkətə keçdi.

Nəzm

“Fələk ucalığına malik şah qoşun və məiyyətlə,
Uzun ömür kimi yerindən yola düşdü.
Fəth və zəfər sağdan və soldan,
Şahın və hökmdarın üzəngisində rəvandır.
Gözəl atlar sürətlə yol gedirlər,
Onlar əziz ömürdən daha tələskəndirlər.
Çevik döyüş atlarının nallarının parıltısından,
Sanki zəmin üstündə rəvan olub yüz min günəş”.

Ağmeyğandan köç edib seşənbə günü, həmin ayın 24-də (15.08.1552) Araz çayı kənarında dayandı. Oradan köçhaköçlə Əxlat qalasının ətəyinə gəldi. O, elə mətanətli bir qaladır ki, uca dağlar onun yanında qum təpəsinə bənzəyirlər və o qədər hündürdür ki, asimanla bərabərlik edir. O qalada yaşayanlar səma sakinlərinə sirr deyirlər və kəmər kimi məntəqətül-bürucun böyrünə toxunurlar. Uçan tərlan kamil dərəcədə yüksək uçsa da, onun ən alçaq yerinə çatmır.

Şeir

“Bir daş qayadır ki, çıxmış səmanın başına,
O, dalğaları dəf edən bərk qranit kimidir.
Elburza bənzəyir onun hər daş parçası,
Naxışlı asiman onun üzərində sanki pələngdir.
Əgər bir kəs oraya gedib çıxarsa,
Əcəlin əli o şəxsdən üzülər”.

Əxlat sakinlərinin beyni xıltların (“əxlat”ın) üfunəti səbəbindən gicəlləndiyi üçün o bürcün möhkəmliyinə və mətanətinə güvənib qarşıdurma və vuruşma məqamında dayandılar və Allahın “Harada olursunuz olun, hətta uca (möhkəm) qalalar içərisində olsanız belə, ölüm sizi haqlayacaq”[2385] kəlamının sirrindən qafil və xəbərsiz qaldılar. Özlərini təhlükəyə atmaqdan savayı bir tərz bilməyən və müharibəyə qədəm qoymaqdan başqa bir işlə məşğul olmayan qalibiyyətli qoşunun bahadırları qalanı dairə kimi araya aldılar.

Beyt

“O qalanın ətrafına yüz şövkətlə,
Elburz dağı kimi səf çəkdilər”.

Qalxanlarını başlarına çəkib, pələng kimi qala bürcünə dırmandılar.

Şeir

“Biri yuxarıya çıxdı kəmənd zoru ilə,
Necə ki, günəş asimana yüksəlir.
Digər biri Fərhad kimi çalışdı,
Öz bazusu ilə polad kimi iş gördü”.

Neçə gün ərzində bu minvalla sübhdən axşama və axşamdan sübhə qədər aslan ürəkli igidlər və düşmən parçalayan bahadırlar mərdanəlik etdilər. Axırda ordubazarçılar şəhər küçəbəndlərini ələ keçirdilər. Rumilər can qorxusundan qalanın içinə qaçdılar. Əldən iti[2386] lağımçılar lağım vurdular.

---

[2384] Bakı nüsxəsi: “nəfis qumaşlar”.
[2385] *Qurani-Kərim, “Nisa” surəsi, 78-ci ayə.*
[2386] Baroda nəşri: “əli xeyirli”.

Nəzm

“Zaman cəngavəri gördü ki,
Ovucla asimanı tutmaq olmur.
Fəth üçün bir tədbir fikirləşdi,
Torpağı lağımla dəlib-deşdilər.
Qazıdılar sağdan və soldan,
Bir anda hasar bürclərinin [altını] boşaltdılar”.

Hasarın bürclərini xarab etdilər. Nadir hadisələrdən biri odur ki, qalanın böyründən bir çay axırdı. Hasarın bürclərindən ta çaya qədər təxminən üç yüz zər [məsafə] vardı. Bir şəxs [hündürdən] bürcün yanına düşsə də, ona bir zərər dəymədi. Qala kutvalı iztiraba düçar olub, miskinlik və acizlik qapısından içəri girdi və qalanı təslim etdi. Qalibiyyətli əsgərlərin zərbəsi ilə o hasar yerlə yeksan edildi.

Dinin pənahı olan şah Əxlata hərəkətdən öncə əksər əmirləri Van ətrafına göndərmişdi. Onlar Van qalası ətrafına çatdıqda, qala camaatının cəsarətlənərək döyüşə və vuruşa çıxmasını təmin etmək üçün min süvarini qabaqcadan göndərdilər. Özləri [isə] yavaş və asta şəkildə onların ardınca hərəkətə gəldilər. Fərhad paşa və Bədir bəy Bəxti Kürdüstan əmirlərindən on nəfərlə[2387] Van qalasından çıxdılar. Qazilər döyüşə-döyüşə əmirlərə doğru çəkildilər. O əsnada adlı-sanlı əmirlər bəla əlamətli ordu ilə göründülər. Rum ordusu və kürdlər döyüşməyə tab gətirməyib qalaya tərəf qaçdılar. Qızılbaş dilavərləri onları qovub Bəxti kürdlərindən[2388] və rumi tayfasından altmış nəfəri gedər-gəlməzə göndərdilər. Vanın, Vostanın, Əmükün, Gevaşın, Əlbaqın və Xoşabın[2389] bütün taxıllarını və mənzillərini yandırdılar və xarab etdilər. [Daha sonra qızılbaşlar] Gözəldərə yolundan, Əxlat diyarının o tərəfindən gəlib əzəmətli orduya qoşuldular.

O zaman Tehran qorçuları, Məhəmmədi bəy Türkman və Əmirşan bəy Bayat[2390] qəzavü-qədər kimi cərəyan edən fərmana əsasən, aləmin pənahı olan dərgaha gəlirdilər. Mərdimazar və fəsadçı kürdlərə rast gəldikləri hər yerdə onları qarət edirdilər. Onlar Əlbaqa çatdıqları vaxt Kürdüstan hakimləri Zeynal bəy və Şahqulu Bəlilan batil düşüncə ilə qüdrətsiz bir dəstə toplayıb müqavimətə və döyüşə hazır oldular. [Lakin] zəfər şüarlı qoşunların gəlişinin səs-küyünü eşitdikdə fərar yoluna tələsdilər. Qazilər o vilayəti çalıp-çaparaq Vostanda əmirlərin ordusuna qoşuldular. Dinin pənahı olan şah Şahverdi sultan Ziyadoğlunu və Ədhəm bəy Rumlunu Pasinə basqından sonra Bitlisə yolladı. Elə ki onlar Muş qalasına çatdılar, qəflətən o diyarın sipahilərinin üstünə tökülüşdülər və bir sıra [sipahiləri] qətlə yetirdilər. Çoxlu adamlardan ibarət bir dəstə döyüş əzmi ilə qaladan çıxdı. Onların əksəriyyəti aslan ovlayan dilavərlərin qılınclarına yem oldular. Qazilər sözügedən ölkəni yandırıb Bitlisə yollandılar. [Oranın] hakimi Mustafa bəy *Mükri*[2391], Nasir bər Rizqi[2392] və Əbdal bəy üç yüz[2393] süvari ilə döyüş və vuruş iradəsi ilə qaladan çıxdılar. Qazilər o şövkətli güruhdan bir çoxlarını qətlə yetirdilər. Qılıncdan qurtulanlar ölüm pəncəsindən xilas olub qalaya qaçdılar. Əmirlər o diyarı çalıb-çapdılar, yandırdılar və Əxlatda ali orduya qatıldılar.

O əsnada Gürcüstandan xəbər çatdı ki, İsgəndər paşa Bayram bəy Qacara qalib gəlib. Hadisə belə olub ki, Bayram bəy, Keyxosrov Gürcü ilə ittifaqda Davelinə getmiş və orada iki-üç qala tutmuşdu. O əsnada İsgəndər paşa Ərzurumdan çoxlu ordu ilə onların üzərinə sürətli yürüşə çıxıb, gözlənilmədən əmirlərin ordugahına həmlə etdi. Həmin günlərdə Bayram bəy və Keyxosrov basqına getmişdilər. Toyqun bəy Qacar və Bədir bəy Yüzbaşı ordugahda idilər. Onlar naçar şəkildə [İsgəndər paşanın] qarşısına getdilər və mərdliklə döyüşdülər. Rumilərin çoxluğu və düşmənin say üstünlüyü həddən və hüduddan artıq olduğu üçün qazilər yüyənlərini dartıb fərar etdilər. İsgəndər paşa qazilərdən və gürcülərdən təxminən üç yüz nəfəri qətlə yetirdi və dərhal Ərzuruma geri qayıtdı.

---

[2387] Baroda nəşri: “iki nəfərlə”. Ə.Nəvai buradakı rəqəmin “iki min nəfər” oxunmasının daha doğru olduğunu düşünür *(Nəvai, şərhlər, s.1353).* Lakin nəzərə almaq lazımdır ki, mətnin bu yerində “iki nəfər” və ya “on nəfər” ifadələri ordunun ümumi sayını deyil, yalnız əmirlərin sayını göstərir.

[2388] Bəxti (Büxti) – Diyarbəkr və Vanda yaşayan kürd tayfası *(Seddon, şərhlər, s.278).*

[2389] Gevaş və Əlbaq – Hakkari kürdlərinin qalaları idi. Xoşab – Mahmudi kürdlərinin mərkəzi idi *(Seddon, şərhlər, s.278).*

[2390] Bakı nüsxəsi: “Məhəmməd bəy Türkman və Əmirşahi bəy Bayat”.

[2391] Bakı nüsxəsi (213a).

[2392] Bəzi başqa əsərlərdə Zirqili (Zırkili) Nasir deyə qeyd edilmişdir *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi, s.215).* Bəlkə də, Rizqi əvəzinə Ruzəki olmalıdır.

[2393] Bakı nüsxəsi: “üç min” (213a).

**Dinin pənahı olan şahın aləm sakinlərinin şahzadəsi İsmayıl mirzəni Ərzuruma göndərməsi, İsgəndər paşanın o sərhəddə və o ölkədə məğlubiyyətə uğraması haqqında söhbət**[2394]

Elə ki bu xəbər ali [hökmdarın] qulağına çatdı, qəzavü-qədər kimi cərəyan edən fərman verildi ki, o ordunun öndəgedəni və o qoşunun Cahan Pəhləvanı olan aləm sakinlərinin şahzadəsi və cahan sakinlərinin gözünün nuru Şücaüddövlə İsmayıl mirzə bir dəstə bahadırla İsgəndər paşanı dəf etmək üçün Ərzuruma yollansın. Adlı-sanlı əmirlərdən Şahverdi sultan Ziyadoğlu, Bədir xan Ustaclu, Şahqulu sultan Ustaclu, Məhəmməd bəy Türkman, Ədhəm bəy Rumlu, Əmirqeyb Ustaclu, Allahqulu bəy Ayçəkoğlu, Həmzə bəy Talış, Xəlifə Ənsar, Uluğxan bəy Səədlü, İbrahim xəlifə Alpavut, Zülfüqar bəy Pazuki, Qünqürat sultan Rumlu, min [nəfər] Tehran qorçusu, altı yüz Naxçıvan qorçusu aləm sakinlərinin şahzadəsinin sərəncamına verildilər[2395]. Qazilər sürətlə yola düşdülər. Aləm sakinlərinin şahzadəsi, Şahverdi sultan Ziyadoğlunu, Məhəmmədi bəy Türkmanı və Ədhəm bəy Rumlunu mənqəlay təyin edib Pasinə yolladı. Özü isə nəfis vücudu ilə, ağır daş dağları həmlə küləyi ilə yerindən qaldıran, oxun ucu ilə Tiri (Merkuri planetini) öz oxundan dəbərdən, düz nizə ilə Müştərinin üzüyünün qaşını çıxaran və dava atəşini alovlandırdıqları zaman oxun ucu ilə günəşin zərnigar qübbəsini fələklərin lacivərd sipərinə tikən çox sayda kinli əsgərlər, zəmanə igidləri və döyüş canbazları ilə onların ardınca Pasinə tərəf hərəkətə gəldi.

Beyt

“Əgər bazularını fələyə doğru uzatsalar,
Ülkər salxımını oxla qopararlar”.

Pasində olan Rum qoşunları qızılbaş ordusuna məğlub oldular və onlardan üç yüz nəfər qətlə yetirildi. Onların qılıncdan qurtulanları Ərzuruma getdilər. İsgəndər paşa bu xəbəri eşitdikdə Ərzurum qullarağasını iki yüz əlli süvari ilə qaravulluğa göndərdi. Onlar əmirlərin əlli nəfər mülazimi ilə rastlaşıb döyüşdülər və məğlub oldular. İsgəndər paşa aləm sakinlərinin şahzadəsinin[2396] hərəkətindən xəbərdar olduqda, Rum əmirlərini çağıraraq onlarla məşvərət etdi. Onların əksəri dedilər:

Beyt

“Bizim onun meydanına çıxmağa taqətimiz yoxdur,
Fəth ayəti onun şanına aiddir.
Bu meşədə peşəsi zəfər olan odur,
Əgər bir şir varsa bu meşədə, məhz odur”.

- Məsləhət budur ki, şəhərdən çıxmaq lazım deyil. Arxamızı arxayınlıqla qalanın möhkəmliyinə dayayaq və top-tüfəng zərbəsi ilə qalanı qızılbaş qoşununun hücumundan qoruyaq.

Amma o zaman Ərzincan, Tərcan, Bayburd, Kəmax, Məraş, Trabzon və Kürdüstan vilayətlərindən cəmləşmiş türklərin və kürdlərin çoxluğu səbəbindən İsgəndər paşanın pərişan beyninin yuvasına lovğalıq və qürur quşu qeyri-mümkün xəyalın yumurtasını qoymuşdu. Buna görə də o, əmirlərin sözünü qəbul etmədi və dedi:

- Hərb tərtibinə, vuruş və zərbə alətlərinin (silahların) hazır edilməsinə başlamaq lazımdır.

Nəzm

“Bu qalada olmaq məni təngə gətirir,
Sanki bürc mənim vəbalımdır.
Kişinin qalası qılıncı və bazusudur,
Gildən və torpaqdan hasar kara gəlməz.
Fələk usanar o kişinin adından,
Əgər hərb meydanından qaçarsa o”.

Rum əmirləri onun boş və ağılsız təklifini qəbul edərək bəla quyusuna və həlak çuxuruna düşdülər. İsgəndər paşa ertəsi gün yardımçılarından və tərəfdarlarından [ibarət] çoxsaylı bir dəstə ilə, piyadalardan və süvarilərdən [ibarət] xeyli qoşunla hərb və savaş əzmi ilə qaladan çıxdı, şəhərin yarım fərsəxliyində döyüş və

[2394] Məclis nüsxəsi: “Aləmin və aləm sakinlərinin şahzadəsi olan İsmayıl mirzə cənablarının İsgəndər paşa ilə müharibə etməsi”.
[2395] Bakı nüxsəsində (213b) naqisdir: “Şahverdi bəy Rumlu, Əmirqeyb bəy Ustaclu...” (ardı burada olduğu kimidir).
[2396] Tehran nəşrində yanlışlıqla “aləm sakinlərinin padşahının” yazılmışdır. Halbuki bu yürüşə padşah (Şah Təhmasib) deyil, şahzadə (İsmayıl mirzə) komandanlıq edirdi.

vuruş səfi tərtib etdi və yeniçəriləri iyirmi ərradə ilə ordu səfinin önündə saxladı. Bu tərəfdən aləm sakinlərinin şahzadəsi köçhaköçlə Ərzuruma hərəkət etdi. Pasin mövqeyində cah-calalla dayandıqda Ədhəm bəy Rumlunu qaravulluğa göndərdi. Onlar İsgəndər paşanın mülazimlərinə çatdılar. [Düşmənlərin] çox qələbəlik olmalarına baxmayaraq, [qızılbaşlar] onlara əndişəsiz bir şəkildə həmlə etdilər və birisini tutub aləm sakinlərinin şahzadəsinin yanına göndərdilər. O əsir bəyan etdi ki, İsgəndər paşa qaladan çıxıb, döyüşə və vuruşa hazırdır. İsmayıl mirzə səba və şimal küləklərini ötən, ipək kimi saçları olan, dağ kimi yerində dayanan və qırmancın işarəsi ilə quştək qanad açan,

Şeir

“Səma kimi iti yeriyən, yer kimi yük saxlayan,
Tale kimi yol bilən, kaman kimi uzaqgörən,
Üzük naxışının arasında qarışqa kimi yol gedən,
İynənin gözündən ipək tel kimi keçən”

bir ata minib döyüş və vuruş meydanına yollandı. [İsmayıl mirzə] ordunu dəstə-dəstə onun (İsgəndər paşanın) dəf edilməsi üçün göndərdi. İlk öncə əmirlərdən Məhəmmədi bəy Türkman, Ədhəm bəy Rumlu və Əmirqeyb sultan Ustaclu savaş meydanına çataraq həmlə etmək və baş kəsməklə məşğul oldular. Uluğxan bəy Səədlü, İbrahim xəlifə Alpavut və b. qazilər mübarizə meydanına [at] çapdılar və tamam sağ (meymənə) və sol (meysərə) cinahlarda döyüş başladı. Qoşun dəstələri və ordu hissələri hər iki tərəfdən bir-birinə qarışdılar.

Nəzm

“İgidlər diş ağardıb, gülə-gülə getdilər bəla kamına,
Və hər iki tərəfdən fitnə əjdahası caynaq açdı.
Mizraq oynadanlar əcəlin uzun yolunu qısa etdilər,
Tunc ney oldu ölülərin yastığı üstündə növhəgər.
Döyüşçülər bəla tozunu yüz halqa etdilər zireh kimi,
İgidlər xəncər üzərinə üz qoydular qalxan kimi.
Birisi “ta” hərfi kimi göz qoydu oxun ardınca,
İkisi “lam” və “əlif” kimi nizə vurub bir-birinə”[2397].

Bir-birinə gürz, nizə, qılınc və xəncər vurdular. Buluddan yağış yağdığı kimi, qılıncdan qan yağırdı. Dilavərlərin meyitlərindən və mübarizlərin cəsədlərindən çöl asimanla bərabər olmuşdu. Xəncərin ildırımı bahadırların canına gülür və Misri qılıncın göz yaşı ölülərin halına ağlayırdı. İsgəndər paşa qızılbaş əsgərlərinin igidliyini müşahidə etdikdə qəm və kədər qulduru onun könül şəhristanına basqın etdi və qorxudan başında beyni və mədəsində ödü cuşa gəldi. Onun dərisi nərgiz gülü kimi sap-sarı saraldı və lalənin şehi kimi damarlarında qan donub qaldı. O, can qorxusundan bir dəstə rumi ilə mərkəzdən ayrılıb, qazilərə həmlə edərək onları geri oturtdu. Bu əsnada əmirlər və b. qazilər İsgəndər paşanın ətrafını və yan-yörəsini dövrəyə aldılar, iti qılınc və atəş saçan nızə yarası ilə o külbaş sərgərdanların həyat damarını çıxardılar. Qılınc öz dilini çəkib, “Hər bir kəs (hər bir canlı) ölümü dadacaqdır. Sonra da (qiyamət günü) hüzurumuza qaytarılacaqsınız!”[2398] ayəsinin məzmununa uyğun surətdə sərsəm rumilərin başına qaxınc etdi və şiddətli intiqam alan Qəhharın[2399] (Allahın) qəzəbinin zərurətinə müvafiq olaraq, qan tökən nizə əfi ilan kimi pis taleli düşmənlərin bədənlərinin divarlarında özünə yer elədi.

Nəzm

“Nizə zirehə elə oturdu ki,
Sanki əfi ilan öz yuvasına girdi.
Zireh iti nizənin yarasından,
Yaş tökən gözlər kimi qana bələndi.

---

[2397] Əsərin bir çox digər yerlərində olduğu kimi, bu beytdə də məcazlardan istifadə olunmuşdur. Ərəb əlifbasındakı “ta” (ت) hərfinin üzərində iki nöqtə olduğu üçün o, atdığı oxun ardınca baxan döyüşçünün iki gözünə bənzədilmiş, “lam” və “əlif” hərflərinin bir-birinə birləşmiş şəkli (لا) isə bir-birinə nizə vurmuş iki əsgərə oxşadılmışdır.
[2398] *Qurani-Kərim, “Ənkəbut” surəsi, 57-ci ayə.*
[2399] Qəhhar – ərəb sözü olub, “cəzalandıran” deməkdir və Allahın adlarından biridir.

Almaz kimi qılıncdan bədəndə açılmış dəlik,
Elə bil ki, arx idi, lakin onun suyu qan seli idi.
İgidlərin qanına bulaşmış döyüş təbərzini,
Lalə rəngli gözəllərin üzlərindəki ğazə[2400] kimi idi.
Sitəm qılıncından kin gürzü sındı,
Necə ki, sənubərin barı düşər torpağa".

Bu tərəfdən qızılbaş qoşunları məst dəvələr kimi köpük salaraq və rəcəz[2401] oxuyaraq, döyüş meydanına girib düşmənin ruh süvarisini bədən atından piyada edirdilər. Digər tərəfdən, rumilər dəstəsi qiyyə çəkib, qartallar kimi ölümcül dimdiklərini mübarizlərin bədənlərinə vuraraq onları yaşayış kürsüsündən həlak torpağına sərirdilər.

Nəzm

"Elə ağır bir döyüş baş verdi ki,
Asimanda ay qorxusundan gizləndi və günəş qaçdı.
Zəmanənin ağılı başından çıxdı,
Asimanın qulağı səs-küydən deşildi.
Göz qanından bütün dünya nəm çəkdi,
Bəs qədər ölüdən zəmanənin beli büküldü".

[Ruh] bədəndən ayrılaraq buxar kimi aşağıdan yuxarıya getdi, külək və atəş kimi yer üzündən [çıxıb] əsl mərkəzinə və həqiqi məskəninə tələsdi. Bu nilgün qəfəsin altında (mavi səmada) ruh quşunun pərvazından ruhlar aləmi peyda oldu.

Şeir

"Ruh asimana doğru elə rəvan oldu ki,
Günəş ruhlar dəryasına qərq oldu".

O əsnada aləm sakinlərinin şahzadəsi qorxunc bəbir və qəzəbli şir kimi bir dəstə qorçu ilə döyüş meydanı üzərindəki bir təpənin üstünə çıxdı. Rumilərin gözü o həzrətin bayrağına düşdükdə onların sabitqədəmliyinin sütunları sarsıldı və öz idbar yüyənlərini fərara doğru çəkib apardılar. Qazilərin qorxusundan yeniçərilər tüfənglərini qoyub qalaya tərəf qaçdılar.

Şeir

"Düşdü rumilərin tüfəngi əldən,
Atəşdən ayrı düşdü atəşpərəst.
Araba düşüb qaldı ağac kimi,
O, təbərzinin cövründən parça-parça oldu".

Qazilər onların hamısını qətlə yetirdilər. Onların (öldürülən yeniçərilərin) sayı beş yüz nəfərdən çox idi. İsgəndər paşa rumilərin bir dəstəsi ilə şəhərə tərəf üz qoydu. Qızılbaş qoşunları onların ardınca sürətlə at çapdılar və hər kimə yetişdilərsə, qətlə yetirdilər. İldırım kimi nizə o gün qiyamət nümayiş etdirərək Cabbarın (Allahın) [cəhənnəm] şöləsindən xəbər verirdi və başkəsən qılınc rumilərin başları üzərində asimandan gələn bəlanın məzhəri olmuşdu. Ona görə də [rumilərin] camaatı çox çarəsiz vəziyyətə düşüb qalmış, [qalanın girişi] at və adamla dolmuşdu. O qədər çaş-baş olmuşdular ki, hətta darvazanı bağlamağı unutmuşdular. Belə ki, Məhəmmədi bəy Türkmanın mülazimlərindən üç nəfər onların ardınca qalanın içinə girmişdi.

O həzrət (İsmayıl mirzə) istədi ki, nəfis vücudu ilə rumiləri dəf etmək əzmi ilə meydana getsin.

Nəzm

"Sərtliklə sıyırdı tələskənlik qılıncını,
Su dəryası kimi o atəş tufanının üstünə getmək istədi.
Ordu başçıları yalvar-yaxar etdilər,
Hamısı yüyənindən asılıb qaldılar.
Yüz üzrlə dedilər ki, ey tac bəxş edən,
Sən mülkün günəşisən, şimşək kimi oynama".

[2400] Ğazə – üzə çəkilən qırmızı rəngli qadın parfümeriyası.
[2401] Rəcəz – döyüşdən və güləşdən öncə pəhləvanların üz-üzə dayanaraq oxuduqları şeir.

Bədir xan və Şahqulu sultan Lələ aləm sakinlərinin şahzadəsinin yüyənini tutub qoymadılar ki, irəli getsin. O həzrətin qəzəb odu alışdı, onları acıladı və qılıncını çəkib həmlə etdi. Onlar onun yüyənini buraxdılar. O əsnada qorçular qoymadılar ki, [İsmayıl] mirzə özü döyüşə atılsın. Həqiqətən, əgər o həzrətə imkan versəydilər, qazilər qalaya girib o hasarı (qalanı) tutardılar. Xəndəkdə və başqa yerlərdə öldürülənlərdən savayı, həmin hərb meydanında rumilərdən iki min beş yüz yetmiş altı nəfər[2402] qətlə yetirildi. Mötəbər əmirlərdən Mərəş hakimi Kəbir İsa, Misir padşahı Sultan Qansu zamanında Hələb hakimi olmuş Xeyirbəyin qardaşı oğlu Mahmud bəy, İsgəndər paşanın qardaşı Ramazan bəy, Çəmişkəzək hakimi Pir Hüseyn bəy, Malatya hakimi Xeyrəddin bəy, Trabzon valisi Mustafa bəy, Pasin əmiri Heydər bəy, Əli ağa Qullarağası, Bayburdlu Məhəmməd bəy, İsgəndər paşanın arvadının qardaşı Əli bəy və Ərzurum qazısı əsir oldular. Həyat paltarını ölüm küləyinə vermiş digər əmirlərin, mötəbərlərin, adlı-sanlıların, seçkin və misilsiz süvari olan cavanların sayı həddən və hesabdan artıq idi.

O əsnada Qaraman hakimi Osman paşa və Xızır paşa Zülqədər Ərzincanda idilər. Qəflətən onların ordusunda [qızılbaşların] sürətli yürüşü və [rumilərin] məğlub olması xəbəri yayıldı. Belə ki, qan selinin axdığı və döyüş alovunun şölələndiyi vaxt [rumilərdən ibarət] bir dəstə özünü [onların] ordusuna yetirmiş və qorxunc xəbəri öldürücü zəhər kimi onlara çatdırmışdılar. Onlar can qorxusundan Ərzincanı qoyub fərar etdilər. Aləm sakinlərinin şahzadəsi qalanın yanında dayanıb neçə gündən sonra əzəmətli orduya yollandı.

**Dinin pənahı olan şahın Ərciş qalasını mühasirə etməsi haqqında**

Dinin pənahı olan şah Əxlatın fəthindən sonra hərəkət bayrağını Ərciş tərəfə qaldırdı. İtaəti vacib olan fərman verildi ki, Bədir xan Ustaclu adlı-sanlı əmirlərdən bir dəstə ilə mənqəlay qaydasında qabaqcadan sürətlə yola düşsün. [Şah isə] mübarək vücudu ilə köç edib Adilcevaz qalası ətrafına gəldi və bir təpənin başına çıxdı ki, qalanın ətrafını gözdən keçirsin. Sultan Süleyman tərəfindən o bölgənin zəbti və mühafizəsi üçün təyin edilmiş Yularqıstı[2403] paşanın oğlu Mustafa bəy həmin qalada idi. Qürur divi onu yoldan çıxardı. O, qalanın mətinliyinə və möhkəmliyinə aldanıb bir dəstəni qaladan bayıra göndərdi. Bəhram [kimi] intiqamçı dilavərlər qan saçan qılıncla onların çoxunu qətlə yetirdilər və oradan köçüb yola düşdülər.

Aləmin müti olduğu fərman verildi ki, cahangir qoşunlar mükəmməl və səhmanlı bir şəkildə hərəkətə başlasınlar. Qazilər səflər bağlayıb nağaraları döyəclədilər və şeypur çaldılar. Ərciş qalası müqabilində fələyə bənzər bargahın qübbəsi ay mənzilinə bərabər oldu. Ora elə möhkəm bir qala idi ki, hər cür tədbirlə xələlə uğramazdı. Elə mətin və yüksək idi ki, hər həmlə ilə süqut etməzdi. Onun təməli möhkəmlikdə ehramların günbəzi ilə bərabərlik iddiası edirdi. Onun bürclərinin hündürlüyü asimanı və Keyvan zirvəsini vurub keçirdi. Xəndəyinin ayağı Səməkin belinə çatıb Ümman dənizinin dibindən xəbər verirdi. Küngürəsinin başı Simakın üstünə çıxıb fələklər fələyinin zirvəsindən xəbər verirdi.

Nəzm

“Sərtliklə girov aparıb ruzigardan,
Ehsan dəryası kimi qapısı möhkəmdir.
Günəş kimi küngürəsinin ucu qəzəbli,
Açılmış sübhün qarşısına o, pərdə salıb.
Çevrəsindəki əzəmətli xəndək,
Dağ ətrafındakı Ümman dənizi kimidir.
Qalanın ətəyində var torpaq istehkam,
Gedir oraya günəş və ay tövşüyərək”.

Belə bir qala çoxlu kürdlər və xeyli yeniçərilərlə dolu idi. Onlar qala müdafiəsi ləvazimatını tərtib edib döyüşə və vuruşa hazır oldular. Adlı-sanlı əmirlər və zəfər şüarlı qorçular qalanın ətrafında dairə kimi yerləşdilər və [qalanı] nöqtə kimi araya aldılar.

Şeir

“O qalanın ətrafında dağ kimi səflər,

[2402] Məclis nüsxəsi: “bir min beş yüz yetmiş altı nəfər”.
[2403] Bakı nüsxəsi: “Yolqulu”.

Çəkdi qiyamət şovkətli qoşun.
İgidlər hər iki tərəfdən, alçaqdan və hündürdən,
Gözəllərin müjganı kimi iki səf qurdular".

Qazilər top-tüfəng atmağa girişdilər. Qala camaatı da bürc və divar üzərindən top və tüfəng atmağa başladı. Bu tərəfdən [mərmilər və güllələr] müstəcəb dua kimi yuxarı aləmə meyil etdi və o tərəfdən ölüm ahəngli tüfəng möhrəsi (gülləsi) müzəffər padşahın düşmənlərinin işi kimi enişə üz qoydu.

Şeir

"Tüfəng ildırım kimi atəş saçırdı,
Onun yağdırdığı dolular isti və can odlayan idi".

Bəzi qazilər tüfəng zərbəsi ilə əcələ qurban getdilər. Qala adamlarının bir qismi sinə sandığını təqdir oxuna hədəf edib can-başdan keçdi. İtaəti lazım olan hökm verildi ki, hər tərəfdən əsgərlər bir döyüş mövqeyi tərtib etsinlər. Fərmana əsasən, ilk öncə Sevindik bəy Qorçubaşı qala yaxınlığındakı bir kilsədə döyüş mövqeyi tutdu. Həsən bəy Yüzbaşı, ox və kaman qorçusu (qurçiyi-tirü-kəman) Hüseyn bəy və b. qorçular da döyüş mövqeləri tərtib etdilər. Topçular daş və top zərbəsi ilə qala divarını əlli gəz uçurdular. O zaman [Rum qoşunu tərəfdən] on dilavər candan-başdan keçib şücaət ayağını qala darvazasından bayıra qoydular və kin qılıncını intiqam qınından çəkib topun yerləşdirildiyi səngərə tələsdilər. Qazilər onlardan təxminən beş nəfəri qılıncla və tüfəng yarası ilə yerə sərdilər. Ondan sonra bir kəsin cürəti olmadı ki, qaladan bayıra çıxsın.

Üç ay müddətində hərçənd çoxsaylı əsgərlər hərb və savaş meydanına qədəm qoymaqda heç bir təqsirə yol verməsələr də, amma qalanın möhkəmliyi səbəbindən və cəhənnəm quyusuna bənzər [qala] xəndəyinin xoşagəlməz dərinliyi ucbatından, hücum etmək və onun bürclərinə dırmanmaq heç cür mümkün olmadı. Dəhşətin və xofun çoxluğundan qala əhlinin ağıl bəbəyi tutulmuş, bəsirət gözü mat qalmışdı və onlar can qorxusundan qalanı qoruyurdular. Dərviş bəy Topçu din və dövlət düşmənlərinin dəf və məhv olunması üçün elə bir top tərtib etmişdi ki, o açılan vaxt zülmətdə göy gurultusu və şimşək kimi çaxırdı və qala əhli onları bürümüş xofu dağıtmaq üçün "İldırımın səsindən ölmək qorxusu ilə barmaqlarını qulaqlarına tıxayanlar"[2404] kimi rəftar edirdilər.

### Dinin pənahı olan şahın Bəktaşoğlunu bir dəstə qorçu ilə Əxlat tərəfə göndərməsi

Dinin pənahı olan şahın aləm sakinlərinin şahzadəsi İsmayıl mirzəni İsgəndər paşa ilə döyüşə göndərmiş olduğu vaxt xəbər gəldi ki, Adilcevaz qalası sakinlərinin (qarnizonunun) məvacibini ("ülufə") ödəmək üçün on xərvar qızıl gətirirlər. O həzrət (Şah Təhmasib) Bəktaşoğlunu yüz əlli qorçu ilə göndərdi ki, həmin qızılı ələ keçirsinlər. Elə ki Əxlata çatdılar, Adilcevaz hakimi olan Yularqıstı[2405] paşa oğlu Mustafa bəy qaziləri dəf etmək üçün təxminən üç yüz nəfər təyin etdi. Qorçular onları məğlub edib qırx yeddi nəfəri qətlə yetirdilər. Onların başlarını və "axtarma"ları (qənimətləri) aləmin pənahı olan dərgaha gətirdilər.

Həmçinin bu il Pəhləvanqulu sultan və Hacım[2406] sultan Özbək Xarəzm tərəfdən İsfərayin ətrafına gəldilər. O diyarın hakimi olan Məcnun sultan Şamlu onlarla müharibə edib qətlə yetirildi. Özbəklər o diyarı qarət edib öz vilayətlərinə geri döndülər.

## 960-CI İLDƏ (18.12.1552 – 06.12.1553) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Ərciş qalasını tutması

Elə ki aləm sakinlərinin şahzadəsi İsmayıl mirzə müzəffər və qalib şəkildə Ərzurumdan qayıtdı, Ərciş ətrafında hökmdar ordusuna qoşuldu. İsgəndər paşa ilə döyüşdə düşmənlərin bədənlərindən ayırdıqları başları qalanın bərabərində asdılar. Qala əhli bildi ki, qızılbaş qoşunlarına müqavimət göstərmək onların qüvvət və qüdrəti daxilində deyildir. Onlar bir-biriləri ilə məşvərət edib dedilər ki, dinin pənahı olan şahla düşmənçilik etmək tam cəhalət və xalis bədbəxtlikdir. Buna görə də onlar qala hakimi İbrahim bəy Bəxtini qətlə yetirdilər və qaziləri xarab olmuş bir divardan yuxarıya çəkdilər.

---

[2404] *Qurani-Kərim, "Bəqərə" surəsi, 19-cu ayə.*
[2405] Bakı nüsxəsi: "Yolqulu".
[2406] Bakı nüsxəsi: "Hacımqulu".

Şeir

"Yenidən döyüşkən qoşunlar,
Ənqa kimi cumdular Qaf dağına.
Cumdular divar üstünə savaş ərləri,
Tutdular o qalanı dərhal".

Əksər kürdləri əsir edib [qaladan] aşağıya endirdilər və onların başlarının dərisini soydular. Qəzavü-qədər kimi cərəyan edən fərman verildi ki, qalanı viran edib özülündən yıxsınlar və düşmənlərin arzu qəsrini viran etsinlər. Fərman icraçıları o qalanı xaraba qoydular.

**Bargiri qalasının fəthi**

Ondan sonra qələbə şüarlı bayraqlar Pərvərdigarın hifzi altında Bargiri qalasına tərəf yollandılar. O diyarın havası kama çatmış padşahın atının dırnağından çıxan tozdan müşk ətri verməyə başladıqda qalibiyyətli əsgərlər iqtidar bayraqlarını yüksəltdilər və çalışqanlıq üzünü qalanı zəbt etməyə yönəltdilər.

Beyt

"Yenidən qoşunlar qalxan əllərində,
Çəkdilər o qalanın ətrafında səf".

Ora elə bir istehkamdır ki, onun divarı ucalıqda Keyvan eyvanını keçmişdir, ulduzların və fələklərin gözü onu müşahidə etməkdən mat və heyran qalmışdır. [O qala] son dərəcə yüksək olan möhkəm bir dağdır və olduqca əlçatmaz olan yüksək bir asimandır.

Nəzm

"Əcəb qaladır ki, fələkdən üstündür,
Başı Simakdadır və ayağı Səməkdədir.
Küngürəsinin başı günəşin baş xəncəridir,
Yaralar vurur asimanın hasarına.
Fələkdən oraya yetərincə yol olduğu üçün,
Fitnənin əli ona çatmır.
Onu nəzər etməyə qorxur ordu,
Necə ki, borcu [geri] istəyəni görməkdən yoxsul qorxar".

Rum padşahı Sultan Süleyman tərəfindən o qalanın kutvalı olan Məhəmməd bəy Zakiroğlu qala darvazalarını bağlayıb ox və tüfəng atmağa başladı.

Beyt

"Bağladılar qapıları kin ahəngi ilə,
Asiman fitnə qapısını bağladı yerin üzünə".

Bütün əsgərlərə qəzavü-qədər kimi cərayan edən fərman verildi ki, hər tərəfdən döyüşə başlasınlar. Fərmana əsasən, dilavərlər qala divarı bərabərində top və qazğanlar quraşdırdılar. Əmirlərdən hər biri bir bürcün müqabilində səngər [tərtib] etdilər. Toplardan atəş açdılar. Quşların və vəhşi heyvanların qulaqları qazğan daşının fəryadının və gurultusunun təsirindən, sözlə ifadəsi mümkün olmayan bir dəhşət və hiddətlə "Qiyamət vaqe olacağı (qopacağı) vaxt"ın[2407] avazını dinləyirdilər. Günəşlə ayın qulağı top daşı zərlərinin zərbəsindən eşitmə duyğusu qüvvəti ilə "Ürəkləri dəhşətə salan qiyamət! Nədir qiyamət?! Sən nə bilirsən (haradan bilirsən) ki, nədir qiyamət?!"[2408] sədasını eşidirdi. Bürcləri və divarları elə dağıtdılar ki, "Onların altını üstünə çevirdik"[2409] [ayəsinin] doğruluğunun sübutu müşahidə edildi. Qızılbaş qoşununun dilavərləri neçə gün xəncər vuran günəşin zərnigar bayrağının bu mavi hasarın (səmanın) damında doğduğu vaxtdan ta sabit və səyyar göy cisimlərinin məşəllərinin dövr edən asimanın bürcü üzərində şölələnməsi zamanına qədər hərb və savaş alətlərini işlətməklə məşğul oldular. Qala adamları da yetərincə qiymətli matah olan candan və başdan vaz keçib, bürclərin və divarların üstünə çıxaraq tüfəng atırdılar. [Amma axırda] qazilərin qorxusundan Zakiroğlunun və b. rumilərin təbiətinə dəhşət atəşi düşdü və başlarından heyrət tüstüsü çıxdı. Onlar bürc-

---

[2407] *Qurani-Kərim, "Vaqiə" surəsi, 1-ci ayə.*
[2408] *Qurani-Kərim, "Qariə" surəsi, 1-3-cü ayələr.*
[2409] *Qurani-Kərim, "Hicr" surəsi, 74-cü ayə.*

lərin başına gəlib aman istədilər. Dinin pənahı olan şah onların günahından keçib onlara qayğı göstərəcəyi barədə əmin etdi. Məhəmməd bəy Zakiroğlu qaladan çıxıb, aman istəyərək qalanı təslim etdi.

Nəzm

"Çıxdı qaladan ağlar və zəbun halda,
Necə ki, can çıxar bədəndən bayıra.
O zaman müzəffər şahənşahı gördü,
[Şahın] möhtərəm başı çatmışdı çərxi-fələyə.
[Şah] mərhəmət qapısını onun üzünə açdı,
Onu dövran əmirlərindən daha üstün etdi".

Onun halı üzərinə olduqca mehribanlıqla şahanə qayğıkeşlik yeli əsdi və əsirgənməyəcək bir şəkildə qızıldan, xələtdən, atdan ibarət növbənöv hədiyyələrlə ona izzət və hörmət göstərildi. Daha sonra tayı-bərabəri olmayan padşah səadət və uğurla Bargiridən köç edib Divcamə keçidindən keçdi və aləm sakinlərinin şahzadəsini Kürdüstan vilayətinə basqına göndərdi. Qazilər o səhradakı kürdlərin əksərini düşmənçilik dimdiyi ilə quş kimi dənlədilər. O diyarın hakimi olan Şahqulu sultan Bəlilan, Kürdüstan sərdarları ilə birlikdə günəşin qılıncından qaçan ulduzlar kimi fərar yolunu tutdu. Onlar Binatünnəş kimi öz yaxınlarından və diyarlarından uzaq düşdülər. "Kafir olanları ilk dəfə (bir yerə) toplayıb öz yurdundan çıxardan Odur"[2410]. Bəziləri zəlil və rəzil olub fəlakət zəncirlərinə və bədbəxtlik buxovlarına bağlandılar. Atlardan, qatırlardan, nökər-naibdən, mal-qaradan, xidmətkarlardan, oturanlardan, duranlardan, cansızlardan və canlılardan [ibarət] bütün sərvətlər, mallar və yüklər müzəffər ordunun[2411] ixtiyarına keçdi. O tayfanı elə qırdılar ki, diyarın və şəhərlərin sakinləri o imansız köpəklərin bəlasından əmin-amanlıq tapdılar. Atdan, naxırdan və sürüdən [ibarət] bol qənimətlər fələk əlamətli əsgərlərin qələbələrinin digər bir nəticəsinə çevrildi.

Dinin pənahı olan şah Əlbaqa[2412] çatdıqda, oranın adamları fərar etmişdilər. Qazilər o diyarı yandırdılar. Dinin pənahı olan şah bir dəstə əmiri mahmudi tayfası üzərinə basqına yolladı. Onların (mahmudilərin) sərdarı Həsən bəy fərar vasitəsilə zəfər şüarlı qazilərin əlindən xilas oldu. Onun qardaşı islamın pənahı olan dərgaha sədaqətlə üz tutub, büsatı öpmək şərəfinə nail olaraq padşahın hüsn-rəğbəti və hökmdarın hörməti ilə tay-tuşlarından üstün və yüksək oldu. Dinin pənahı olan şah, İsmayıl mirzəni Sevindik bəy Qorçubaşı, Məhəmmədi bəy Türkman kimi adlı-sanlı əmirlərlə və b. uca məkanlı əmirlərlə ittifaqda Gevar[2413] üzərinə basqına göndərdi. Gevar keçidində elə kəskin qar yağmışdı ki, [İsmayıl] mirzə və əmirlər oradan keçə bilməyərək orduya qayıtdılar.

Elə ki dinin pənahı olan şahın könlü düşməndən arxayın oldu, öz diyarına tərəf geri qayıtdı. Rəbiüssani ayında (17.03.-14.04.1553)[2414] olduqca əzəmətlə və səadətlə [gəlib] Naxçıvan şəhərində cah-calalla dayandı.

### Müxtəlif əhvalatlar

Bu il dinin pənahı olan şah, Əmir Şəmsəddin Dilicanini elçi kimi Ruma göndərdi.

Həmçinin bu il Sultan Süleyman Hələbdə qışlaq etdi.

### Ölümlər

Rum padşahı Sultan Süleymanın oğlu Sultan Mustafa. Bu il vəziri-əzəm Rüstəm paşa ondan razı olmadığı üçün məkr və hiylə üzündən xondgarın ərzinə çatdırdı ki, Sultan Mustafa baş qaldırmaq iddiasındadır. Ona görə də Sultan Süleyman onu (Sultan Mustafanı) qətlə yetirdi. O hadisənin [əbcəd hesabı ilə] tarixi-

---

[2410] *Qurani-Kərim, "Həşr" surəsi, 2-ci ayə.*
[2411] Baroda nəşri: "müzəffər şahın".
[2412] Əlbaq – indiki adı Başkale olub, Van vilayətinin bir ilçəsidir.
[2413] Gevar (mətndə: Kevər) – Türkiyənin şərqində, Hakkaridən şərqdə yerləşən bölgə. İndiki adı Yüksək-ovadır *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi, s.216).*
[2414] Bakı nüsxəsində tarix yoxdur (219b).

ni “məkri-Rüstəm” (“Rüstəmin məkri”) [ifadəsində] tapdılar. Atasından neçə gün sonra Sultan Məhəmməd[2415] də öldürüldü və “sitəmi-mükərrər” (“təkrar zülm”) [əbcəd hesabı ilə] onun tarixi oldu.

Vəkil Qazı Cahan, Qəzvinin Seyfi seyidlərindən idi. Doğrudan da, bu əzəmətli dövlətdə onun mislində qabiliyyət və istedadı özündə cəmləşdirmiş bir vəzir yox idi. Onun şanının ucalığını bəyan etməyə ehtiyac yoxdur. Onun lətif təbiətinin aynası xeyirxahlıq surətinin əksetdiricisidir və müşkülləri çözən rəyinin lampası fəzilətləri göstərən məzhərdir. O həzrətin dərrakəsi, uzaqgörənliyi, fəhmi, zəkasının itiliyi və yüksək fitrəti o dərəcədə idi ki, ali əşrəfin (Şah Təhmasibin) behişt ayinli məclisində elmlərdən hansı biri haqqında müzakirə və mübahisə düşsəydi, həmin mübahisəyə məqbul müdaxilələr edərdi və bəyənilən incə mənalar bəyan edərdi. İnşa və təhrir gözəlliyində, hüsni-xəttə, ibarələr düzəltməkdə və nitq lətifliyində elə həddə çatmışdı ki, qəliz məzmunları və müşkül müddəaları ən müxtəsər ibarələr, ən konkret bəyan və ən lətif işarələrlə, götür-qoy etmədən və təfəkkürə dalmadan, ən qısa zamanda dilə gətirərdi. Fəzilət yaymaq meydanında öz tay-tuşlarından üstünlük və seçkinlik topunu alıb qaçan fəsahət şüarlı münşilərdən və bəlağət əsərli söz ustadlarından heç biri bu vadidə onun səviyyəsinə malik deyildi. Belə ki, onun hökmdar adından hər barədə itaəti lazım olan hökmlər yazması bu mənanın şahididir və [bu hökmlər hələ də] insanların əllərindədir. Hamı onun hörmətini saxlayırdı. Həmişə işlərin icrasında ədalətin və rəiyyətpərvərliyin sərmayəsini İlahi xof və qorxunun bəzəyi edib, dəqiqələrdən bir dəqiqə belə gözəl davranışı və yaxşı rəftarı əldən buraxmamışdı. Şanının yüksəkliyinə baxmayaraq, bütün insanlara təvazökarlıq və sadəliklə davranardı, nitqində və yazısında kamali-ədəbə riayət edərdi və son dərəcə sadəlik nümayiş etdirərdi. Gözəl ədəb və təvazökarlıq elə bir vəchlə onun fitrətinin mərkəzi nöqtəsinə və xasiyyətinin mahiyyətinə çevrilmişdi ki, “...”[2416] ayəsinin dəlili ona münasib gələrdi. Nə zaman ki əşrəfin məclisində lazımi işləri ərz etməyə fürsət olmasaydı, o həzrət (Qazı Cahan) zərurət üzündən adamlara [öz-özündən] ziddiyyətli vədlər verərdi. O səbəbdən adamlar zərərçəkmiş və könlü incimiş olurdular. Halının əvvəlində sözügedən şəxs Qazı Məhəmməd Kaşinin mülazimi idi. Ondan sonra, Mirzə Şahhüseynin vəkilliyi əyyamında Xoca Cəlaləddin Məhəmməd Təbrizi ilə ittifaqda Mirzə Şahhüseynin vəziri oldu. Xoca Cəlaləddin Məhəmməd yandırıldıqdan sonra vəzarət mənsəbi təkbaşına surətdə adı çəkilən seyidə (Qazı Cahana) həvalə edildi. O zaman ki təkəlü və ustaclu tayfaları arasında münaqişə peyda oldu və döyüşlə nəticələndi, sözügedən şəxs (Qazı Cahan) Gilana qaçdı. Uzun müddət Müzəffər sultanın yanında məhbus oldu və nəzarət altında qaldı. Deyirlər ki, Əmir Hüsaməddin o seyidə qarşı malik olduğu qədim ədavət üzündən onu azarlamaq və təhqir etmək üçün heç bir fürsəti əldən vermədi. Qazı Cahanla Nurbəxşiyyə silsiləsi arasında irsi düşmənçilik bərqərar olduğundan və Müzəffər sultan özünü həmin silsilənin müridlərindən biri saydığından, o tərəfdən də [Qazı Cahana qarşı] təhriklər olur və bu da onun əlavə olaraq incidilməsi və təhqir edilməsinə gətirib çıxarırdı. Üzərinə bədbəxtliyin çökməsi ucbatından Müzəffər sultanın həyat qayığı əzab girdabına və burulğanına düşdü və o, taleyin pəncəsində əsir oldu. O hal-qəziyyədə Qazı Cahan Gilandan çıxdı. Yenidən dinin pənahı olan şahın vəzirliyi mənsəbi Əmir Səədəddin İnayətulla Xuzani ilə müştərək surətdə ona həvalə edildi. Adı çəkilən şəxs (Əmir Səədəddin) sözünü etdiyimiz Qazı Cahanı həmişə hörmətdən salmaq və onu alçaltmaq məqamında dayanırdı. Axırda [Əmir Səədəddin] zamanın həmləsindən əziyyətə düşdü (edam edildi)[2417].

Ondan sonra sözügedən seyid (Qazı Cahan) həmin mənsəbdə müstəqil oldu (təkbaşına vəzir oldu) və on beş il müddətində könlünün iradəsinə uyğun şəkildə, rahatlıq və hüzurla ovqatını keçirdi. Ömrünün axırında yaşı altmışı keçib yetmiş və səksən hüdudunda qərar tutduqda, qocalıq zəifliyi səbəbindən “ağarmış surət (saç-saqqal) eybin müqəddiməsidir (başlanğıcıdır)” [kəlamı] onun halında təzahür etdi və “ahıllıq məyusluqdur” [kəlamı] naümidlik əsasını onun əlinə verdi. Daha o vəzirlikdə [əvvəlki] qüdrətə malik olmadı. Divan işlərini tərk edərək rüxsət aldı ki, işdən çıxıb ayağını bekarçılıq ətəyinə çəksin və bir guşədə gündən-günə yüksələn dövlətin davamı üçün dua deməklə, itaət və ibadət vəzifələrini yerinə yetirməklə məşğul olsun. Daha sonra bu əməlindən heyifsiləndi və peşman oldu. Amma peşmançılığının faydası olmadı və Qəzvində məskən saldı. Qəzvində məskunlaşdıqdan bir neçə gün sonra izzətli və cah-calallı [hökmdarın] qulağına çatdı ki, vəqf kəndlərindən bəziləri uzun müddətdən bəri onun ixtiyarındadır və mülkiyyət baxımından o, onları öz

[2415] Sultan Məhəmməd – şahzadə Sultan Mustafanın oğlu.
[2416] Mətndə ayənin yeri boş buraxılmışdır.
[2417] Ellis nüsxəsi: “dilinin ucbatından əziyyətə düşdü”.

təsərrüfatına keçirmişdir. Dinin pənahı olan şahın uzaqgörən düşüncəsi onun haqqında belə qərara gəldi ki, həmin yerləri ən qəbahətli bir vəchlə onun təsərrüfatından çəkib alsınlar və ötən əyyamın müəyyən məbləğ təşkil edən gəlirinin əvəzini ondan geri alsınlar. Bu hadisə gerçəkləşdirilməzdən öncə o, özünü ulu dərgaha çatdırdı. Ali hökmdar onun gəlişinin xəbərini eşidən kimi, onun yenidən vəzirlik arzusuna düşməməsi üçün vəkilliyi və ali divanın vəzirliyini Məsum bəy Səfəvi cənablarına verdi. Qazı Cahan şükür səcdəsinə müşərrəf olduqda Xoca Hafizin bu beytini oxudu:

"Biz bu qapıya həşəmət və məqam ardınca deyil,
Pis hadisədən pənah tapmaq üçün gəlmişik".

Kama çatmış səadətli hökmdar onun acizliyinə, çarəsizliyinə, qocalığına, halının zəbunluğuna və əhvalının pərişanlığına nəzər salıb o hadisənin üstündən keçdi, ona soyurğal qaydasınca bir məbləğ də ayırdı və o, rüxsət alıb Qəzvinə getdi.

Bu il o, Zəncanrudda vəfat etdi. Cəsədini Şahzadə Hüseyn [məqbərəsində] dəfn etdilər[2418]. Onun vəfat tarixi barədə demişlər:

"Əgər on çıxarsan Qazı Cahandan,
Ölüm tarixindən taparsan nişan"[2419].

## 961-Cİ İLDƏ (07.12.1553 – 25.11.1554) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Rumilərin Şəhrizuru ələ keçirməsi[2420]

Bu il Osman paşa, Sultan Süleymanın fərmanı ilə Şəhrizura gəldi. Bigə Ərdəlandan sonra o diyarın hakimi olmuş Sürxab Kürd Zələm qalasına sığındı və bir nəfəri aləmin pənahı olan dərgaha göndərib yardım istədi. Dinin pənahı olan şah, Sultan İbrahim mirzəni, Bədir xanı və Əmirqeyb bəyi bahadırlardan [ibarət] çoxsaylı bir dəstə ilə Sürxab Ərdəlana yardım etməyə göndərdi. Zəfər nişanlı qoşunun qaravulları Rum ordusunun üzdə olan adamlarından bir neçə nəfəri əsir tutub əmirlərin yanına gətirdilər. Ona görə də Osman paşanın ürəyini tamam xof bürüdü və qalanın üzərindən köç edib öz diyarına yollandı.

Fələk şövkətli ordu (şah ordusu) Aralıq mövqeyində olduğu zaman Ruma getmiş olan Seyid Şəmsəddin Dilicani zəfər şüarlı orduya yetişdi və xondgarın göndərdiyi məktubu ("kitabət") təqdim etdi. O məktubda məşriq və məğrib padşahına (Şah Təhmasibə) çox da ehtiram göstərilməmişdi. Ona görə də o həzrət (Şah Təhmasib) aləm sakinlərinin şahzadəsi İsmayıl mirzəni, Məsum bəy Səfəvini və Şahqulu xəlifə Möhürdarı çoxsaylı qazilərdən ibarət bir dəstə ilə Rum padşahının vilayətinə basqına yolladı və Sultan Hüseyn mirzə ilə Şahverdi sultan Ziyadoğlunu Kürdüstana basqına göndərdi. Aləm sakinlərinin şahzadəsi İsmayıl mirzə Vanı, Vostanı, Ərcişi və Adilcevazı qarət edib sağlam şəkildə və qənimətlə orduya qayıtdı. Sultan Hüseyn mirzə və Şahverdi sultan Ziyadoğlu da Gevara basqın etdilər və [oranı] yandırdılar, müzəffər və qalib şəkildə, qeyri-məhdud qənimətlərlə Naxçıvanda zəfər nişanlı orduya qoşuldular.

### Sultan Süleymanın dördüncü dəfə Azərbaycana qoşun çəkməsi haqqında söhbət[2421]

Baharda azar buludu arx kənarında və dağ ətəyində cilvəyə gəldi, xoş səsli quşlar bostan və gülüstanın ətrafında nəğmə oxumağa başladılar.

Nəzm

"Xoş avazlı quşların tərənnümləri,
Getmiş şövqü ürəklərə yenidən vermiş.
Səba mütrüblər kimi oynamağa başlamış,
Nərgiz başına nəvaziş vermiş.

[2418] Məclis nüsxəsi: "Zəncanda vəfat etdi və cəsədini şahzadə Hüseynin – ona salam olsun – təmkinli imamzadə məqbərəsində dəfn etdilər". Şahzadə Hüseyn – şiələrin səkkizinci imamı olan İmam Rzanın oğludur. Məzarı Qəzvindədir *(Seddon, şərhlər, s.279).*

[2419] "Qazı Cahan" adının əbcəd hesabı ilə cəmi 970-ə bərabərdir. Beytin məzmununa uyğun olaraq, bu rəqəmdən 10 çıxdıqda Qazı Cahanın ölüm tarixi olan 960 rəqəmi alınır.

[2420] Məclis nüsxəsi: "Dinin pənahı olan şahın əmirləri Sürxab Kürdün köməyinə göndərməsi və Osman paşanın qaçması".

[2421] Məclis nüsxəsi: "961-ci ildə baş vermiş hadisələr haqqında söhbət".

Tikandan bir budaq ələ almış qızılgül,
Ağlamaq üçün söyüd dırnaq açmış.
Gülzarın hər guşəsindən cah-calal ilə,
Başını çıxarmışdır bənövşə.
Gül-çiçək yeri xara atlas kimi bəzəmiş,
Firəngi [parça] kimi rəngarəng, parə-parə".

Rum padşahı Sultan Süleyman hesablamaqla qurtarmaq olmayan, yağışın damlalarından və ağacların yarpaqlarından artıq [sayda] bir ordu ilə, Zühəl təbiətli, Mərrix görkəmli, tüfəng atan, qılınc vuran rumilərlə və çərxi-fələk kimi kəcrəftar arabalarla Hələbdən çıxıb köçhaköçlə Azərbaycana yollandı.

Elə ki dinin pənahı olan şah bu haldan xəbər tutdu, ucu gövhər kimi parlaq olan kəhrəba rəngli mizraqlarla dağı saman kimi torpaq xırmanından qaldıran və həmlə küləyi ilə ağır daş dağı quru ot kimi sovuran və dağ deşən ox ucunu qranit daşından keçirən igidlərlə Naxçıvandan çıxdı. Bazarçay yaylağı[2422] hökmdarın dayanacaq düşərgəsinə çevrildi. O əsnada Uluğxan bəy Səədlü qaravulluğa yollandı. O, gecənin zülmət hicabı altında Rum ordusunun qaravulu olan Qazan bəyə çatıb ona həmlə etdi. Qüdrətli dövlətin gücü ilə onlara qalib gəlib iyirmi beş nəfəri qətlə yetirdi və onların başlarını hökmdarın dərgahına göndərdi.

O əsnada Sultan Süleyman Naxçıvanın ətrafında düşərgə saldı. Onun rəvan qumdan və çöl qarışqasından artıq qoşunları elə bir tərzdə toplaşdılar ki, ağ rəngli xeymələr (çadırlar) və xirgahlar, alaçıqlar və bargahlar al gündüzdə günəşin çöhrəsindən, qara gecədə ayın çöhrəsindən parlaq idi.

Beyt

"Yetərincə xeymə və pərdə rəngbərəng,
Olub çölün üzü pələngin beli kimi".

O əsnada Həsən bəy Yüzbaşının dil tutmağa getmiş mülazimləri qaramanlılarla döyüşüb onlardan otuz nəfəri qətlə yetirdilər və otuz nəfər digərini əsir edib ulu dərgaha gətirdilər. Məşəl işığında onların boynunu vurdular. Yenidən Uluğxan bəy Səədlü xondgar ordusunun arxasından gedib xondgarın vəziri-əzəmi olan Əhməd paşanın vəkilinə rast gəldi. [Həmin vəkil] çoxlu azuqə ilə xondgarın ordusuna doğru getməkdə idi. [Uluğxan bəy öz dəstəsi ilə] onlardan iki yüz əlli nəfəri qətlə yetirib [şahın] ordusuna döndü. Sultan Süleyman Naxçıvanı yandırıb Ərzurum tərəfə qayıtdı. Günbəgün qələbə nişanlı qoşunların dilavərləri kürdlərə həmlə edib bəzilərini öldürür və bir dəstəsini əsir edib hökmdarın məiyyətinin qarşısına gətirirdilər. Bu minvalla hər gün iyirmi nəfər və əlli nəfər ulu dərgaha gəlirdi. Dinin pənahı olan şah, Şahverdi sultan Ziyadoğlunu Pasinə yolladı. Adı çəkilən şəxs xondgarın [oraya] çatmasından öncə o diyarı yağmalayıb yandıraraq fələk əzəmətli orduya qayıtdı.

Düşmənlərin təkəbbür zirvəsinə qalxmış olan şövkət və iqtidar bayrağı aşağıya endi və onların saysız yardımçılara, tərəfdarlara və qoşuna güvənərək təsəvvür və xəyal lövhəsinə qeyd etdikləri lovğalıq naxışları zay oldu. O dəm dinin pənahı olan şah Bazarçaydan köç edib səadət və uğurla Rum diyarına tərəf yola düşdü.

Beytlər

"Qiyamət [kimi] hücum edən məiyyət və ordu ilə,
Sürətlə çapdı Rum mülkünə tərəf.
Sərsər küləyi kimi tələskən atların nalları,
Yer üstündə yeriyən yüz min günəş kimi idi.
Şövkətlə yeriyən döyüş dəvələri,
Hərəkətə başladı Elburz dağı kimi".

Qazilər Daveli vilayətinə basqın etdilər və çoxlu qənimət ələ keçirdilər. Dinin pənahı olan şah Qanlıçəmən[2423] mövqeyindən İsmayıl mirzəni və Şahqulu xəlifə Möhürdarı adlı-sanlı əmirlərin bir dəstəsi ilə Oltu[2424] tərəfə göndərdi. Ali mənşəli əmirlər, xondgarın fərmanı əsasında bir dəstə rumi ilə yolu təmir etməyə gəlmiş Sinan bəyə rast gələrək, onların əksərini iti qılınc zərbəsi ilə həlak torpağına sərdilər və Sinan bəyi

---

[2422] Bazarçay yaylağı – Azərbaycanın tarixi torpaqlarından olan Zəngəzur mahalında, Bərgüşad çayının yuxarı axarlarında yerləşir.
[2423] Tehran çapında "Qanlı-çəməni" yazılmışdır.
[2424] Oltu – Türkiyənin Ərzurum vilayətinin bir ilçəsidir.

əsir edib hökmdar ordusuna gətirdilər. Xondgar sülh barədə him-cim etdiyindən, dinin pənahı olan şah Sinan bəyin qanının üstündən keçdi (onu bağışladı) və onu Şahqulu bəy Qacarla birlikdə xondgarın yanına göndərdi. Onlar Sultan Süleymana ərz etdilər ki, düşmənçilik məmləkətin viran qalmasına, sülh isə rəiyyətin rifahına səbəb olur.

Şeir

“Əgər sultan açarsa hərb qapısını,
Verər bir aləmi döyüş küləyinə.
Düşmənçilik cahanda elə bir buluddur ki,
Onun seli bir aləmi xarab edər.
Əgər şahlar sülhdən və dostluqdan dəm vursalar,
Həmrəylikdən və dostdarlıqdan dəm vursalar,
Cahan asudə olar qarışıqlıqdan,
Abad olar xarab dünya”.

Sultan Süleyman sülhə meyil salıb Şahqulu bəyin məramına müsbət cavab verdi və ona ənam verərək getməsinə rüxsət verdi. Hər iki tərəfdən küdurət səfa ilə əvəz olundu və əhd-peyman hadisəsi andla təsdiq edildi.

### Dinin pənahı olan şahın dördüncü dəfə Gürcüstana getməsi haqqında söhbət

O zaman xəbərçilər cahan hökmdarının ərzinə çatdırdılar ki, saylarının bolluğuna, qüvvət və istiqlallarının çoxluğuna, dağların ucalığına və təpələrin hündürlüyünə arxayın olan gavurlar ayaqlarını inad dairəsindən kənara qoymuş və başlarını fəsad yaxasından çıxarmışlar. Onların natəmiz sinəsinin sahəsindən imanın təməli sarsılmış, o dinsizlərin bədşükümlüyündən və təcavüzkarlığından müsəlman şəhərlərinin və diyarlarının yolu qırılmışdır. Sanki “Yəcuc–Məcuc [tayfaları] bu ərazidə fitnə-fasad törədirlər”[2425] mənası onların barəsində nazil olmuşdur və “Hər tərəfdən axın edərlər”[2426] məzmunu onların bəd əsilli nəslindən hasil olmuşdur. Elə ki bu xəbər ali [hökmdarın] qulağına çatdı, dinin pənahı olan şah məiyyət və ordu ilə peyğəmbərlər ağası olan həzrətin (Məhəmməd peyğəmbərin) dinini qüvvətləndirmək üçün və padşahanə şərəf hissinin kamilliyi üzündən gürcü kafirlərinin diyarının fəthi məqsədi ilə xoşbəxtlik və səadətlə hərəkət bayrağını Gürcüstana doğru yüksəltdi və Barat-elində cah-calalla dayandı. O diyar tamamilə cəngəllik idi. Belə ki, ağacların çoxluğundan külək oradan çətinliklə keçə bilirdi.

Zəfər şüarlı qoşunların yürüşünün xəbəri pozğun kafirlərə çatdıqda vahimənin çoxluğundan hərəsi bir guşəyə dağıldılar və avara oldular. Davudun oğlu Ləvasan həmin diyarın valisi idi. O, qalalardan, mahaldan və ailəsindən gözünü çəkib yarımcan halda, min hiylə ilə aradan çıxdı və özünü təhlükəsiz bir yerə çatdırdı. Digər gürcülər bu xəbəri və kosun, nağaranın səsini eşitdikdə onların ödləri yarıldı və ciyərləri para-para oldu. Dəniz kimi coşan və ildırım kimi gurlayan ordunun qorxusundan onların sabitlik və qətiyyət xırmanına xof və xətər atəşi düşdü. Onlar öz acizlik əllərini fərar ətəyinə vurub dağlara, mağaralara və cəngəlliklərə qaçdılar. Bir qismi isə möhkəm qalalara sığındılar. Qazilər ağacların arasına gedib, “Müşriklərin hamısı sizinlə vuruşduqları kimi, siz də onlarla vuruşun”[2427] [ayəsinin] zərurətinə əməl edərək o dinsizlərin əksərini amansız cihad qılıncından keçirdilər, onların arvadlarını və uşaqlarını əsir etdilər, çoxlu inək və qoyun qənimət götürdülər. Ondan sonra [Şah Təhmasib] Ləvasanın paytaxtı olan Qoriyə[2428] yürüş üçün aləmi bəzəyən bayrağı yüksəltməyə qərar verdi. Çətin yollardan, ağacla dolu meşələrdən keçdilər. Qalibiyyətli ordu o diyarı da basaraq gül üzlü qızlardan, günəş rüxsarlı oğlanlardan [ibarət] çoxlu qənimət ələ keçirdi.

Fəth ayətli bayraqlar öz gəlişinin kölgəsini Məzərut[2429] qalası üzərinə saldı. [Bu], elə bir qala idi ki, divarının ucalığı cahan şahının bəxti kimi Keyvan zirvəsini keçmişdi və onun təməli qüdrətli dövlətin təməli

---

[2425] *Qurani-Kərim, “Kəhf” surəsi, 94-cü ayə.*
[2426] *Qurani-Kərim, “Ənbiya” surəsi, 96-cı ayə.*
[2427] *Qurani-Kərim, “Tövbə” surəsi, 36-cı ayə.*
[2428] Qori – Gürcüstanda, Tiflisdən şimal-qərbdə, Kür çayı sahilində şəhər.
[2429] İsgəndər bəy Münşiyə görə, “Mərdanqub”, gürcü mənbələrində isə “Martkoph”. Bu, Gürcüstanın Qori şəhəri yaxınlığında tarixi bir qaladır *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi, s.237).*

kimi möhkəm idi. Belə bir keyfiyyətdə tərtib edildiyindən, onun başı göy üzündəki Ülkər ulduzu kimi görünürdü və səma büsatındakı muncuğa bənzər ulduzlar şəklində nəzərə çarpırdı.

Nəzm

“Möhkəm daşı pak cəvahirdir,
Zəminin mismarıdır, fələklərin sütunudur.
Kökü aşağıya elə işləyib ki,
Səməkə doğru min fərsəx yol gedib.
Qılıncı yuxarı elə yüksəlib ki,
Simaka qədər illərlə yol gedib”.

Məhəmmədi (islami) bayraq o dağın üfüqlərində heç vaxt parlamamışdı və iman çırağının parıltısı ilə səadət sübhü o qüllənin ətrafındakı dan yerindən qətiyyən doğmamışdı. Fərmana əsasən, zəfər şüarlı qoşunlar o qalanı dairə kimi ortaya alıb qalanı tutmağın tərtibi ilə məşğul olmağa başladılar. Kafir inanclı gürcülər öz qalalarının möhkəmliyinə güvənərək müxaliflik etməyə başladılar. Kama çatmış əmirlər və adlı-sanlı qazilər ətrafdan və yan-yörədən həmlə etdilər. Axırda qeybdən gələn səs, “Həqiqətən, Biz sənə açıq-aşkar bir zəfər bəxş etdik!”[2430] nidasını o həzrətin (Şah Təhmasibin) qulağına çatdırdı və uğur müjdəçisi bu nidanı söylədi:

Beyt

“Bir qalaya çatdınsa, lap fələk hasarı belə olsa,
Sənin bəxtinlə açılar qapıların kilidləri”.

Qala kutvalı Parsadan fələk qüdrətli igidlərin şiddətinin dəhşətindən iztiraba düşüb, acizlik və miskinlik qapısından girərək itaət qədəmi ilə qaladan çıxdı və qalanı təslim etdi. Dinin pənahı olan şah o qalanın fəthindən sonra Aydın[2431] qalasına yollandı. Ora elə bir qaladır ki, son dərəcə mətanətli və istehkamlıdır. Təsəvvür və xəyal quşunun qanadı onun bürclərinin başına uçmaqda aciz və dövran hadisələrinin əli onun xəndək ətrafındakı torpaq səddinin ətəyinə uzanmaqda qısa və gödəkdir.

Nəzm

“Xəyal quşu ömür boyu uçdu,
Çəpərinin üstünə çata bilmədi.
Təsəvvür kəməndi onun bürcünə çatmır,
Bir pəncərə idi divarında ay.
Onun yanında fələk açlaqdır,
Bulud onun torpaq səddindən toz tutub.
Onun yanında cahan bayquş viranəliyidir,
Fələk onun xəndəyində kəmtər bir köpükdür.
Onun içində bir küncdür rübi-məskun[2432],
Onun bir bürcündən baş qaldırıb səma”.

Amma o qalanın mühafizləri o zaman aznavurlar idi. Ləvasan öz anasını orada qoymuşdu. Qalibiyyətli ordu döyüşə başlayıb, top və lağım zərbəsi ilə o qalanın çəpərini xarab etdi. Cəld və çevik dilavərlər və qorxmaz cavanlar hamısı birdən hücum edib qalaya girdilər.

Nəzm

“Cumdular şirlər divara igidliklə,
O qorxunc qala oldu şir bürcü.
Fələk zəminlə baş-başa hərb etdi,
Səyyarələrdən ətək dolusu daş yağdı”.

---

[2430] *Qurani-Kərim, “Fəth” surəsi, 1-ci ayə.*

[2431] Gürcücə İdin (Eden, Aten) olmalıdır. Bu qala Gürcüstanın Qori şəhəri yaxınlığında yerləşirdi *(F.Kırzıoğlu. Osmanlıların Kafkas-ellerini fethi, s.237).*

[2432] Rübi-məskun – müsəlman coğrafiyaşünaslığında termin. Bu terminlə dünyanın insanla məskunlaşmış dörddə bir hissəsi nəzərdə tutulur.

Gürcülər tam izdihamla qaziləri dəf etməyə üz qoydular. Bir nücum saatı ərzində bürclər ətrafındakı giriş-çıxış yollarında qala fəth edən mübarizlərlə Tanrı düşməni olan müşriklər arasında elə bir döyüş baş verdi ki, asimanın iti görən didələri ona nəzər etməkdən heyran qaldı. Bürcün və divarın başından başsız beyinlər və beyinsiz başlar ağacların bəhrələri kimi payızın sərt küləyindən tökülməyə başladılar. Atəş saçan iti qılıncın yarası ilə o bədkirdar gürcülərin çoxlarını cəhənnəmə göndərdilər. "Onların məskəni cəhənnəmdir. O necə də pis yerdir!"[2433]. Ləvasanın anasını əksər aznavurlarla birlikdə əsir etdilər və şahın dərgahına gətirdilər.

O əsnada xəbərçilər cahan hökmdarının ərzinə yetirdilər ki, bu ətrafda ...[2434] adında bir qala var və bir dəstə gürcü o qalaya sığınmış, müxaliflik bayrağını yüksətmişlər. Dinin pənahı olan şah, Şahverdi sultan Ziyadoğlunu o qalanı fəth etməyə təyin etdi. Adı çəkilən əmir o qalanı döyüşlə ələ keçirib hökmdarın ordusuna qoşuldu. Zəfər şüarlı qoşunlar o diyarda pozğun və yaramaz kafirlərin ixtiyarında olan çoxlu qalanı Həzrət Pərvərdigarın köməyi və kama çatmış bazunun qüvvəti ilə zəbt etdilər və sayları otuz mindən artıq olan xeyli əsir tutdular. Qeyri-məhdud mallarla Bərdəyə gəldilər. Lətif yazan katiblər (dəbirlər) və fəsahət şüarlı, bəlağət əlamətli münşilər o diyarın fəthinin zikrini müşk saçan qələmlə qeyd edib, şad xəbəri Azərbaycan, Şirvan, Şəki, İraq, Fars, Kirman, Sistan, Kürdüstan, Ümman sahilləri və Xorasan vilayətlərinin əhalisinin qulağına çatdırdılar.

### Abdulla xan Ustaclunun Qasım bəy Şirvani ilə müharibə etməsi

Sultan Süleyman Azərbaycana gəldiyi zaman Qasım bəy Şirvanini böyük bir qoşunla Kəfə yolundan Şirvana göndərdi və onlar Dərbənddən keçib həmin vilayətə gəldilər. Şirvan sakinləri dəstə-dəstə Abdulla xandan üz döndərib ona qoşuldular. Cənab xan Həzrət Rəbbin köməyi ilə onları dəf etmək və qarşılarına çıxmaq üçün yola düşdü. Təngə[2435] mövqeyində onlara çatdı. Xoş rəftarlı atını cövlana gətirib onlara həmlə etdi. Xilaf əhli də qılıncını qılafdan çıxardı və müdafiə olunmaqla məşğul oldu. Onlar bir sıra qaziləri yaraladılar. Məkanın istehkamlı olması ucbatından Abdulla xan bir iş görə bilməyib Şamaxıya qayıtdı. Qasım bəy Biqurd qalasına gəldi və qırx gün orada qaldı. Ondan sonra bir dəstə dayaz düşüncəli adamla öz məskənindən çıxıb Gülüstan qalasına yollandı. Çünki Abdulla xan orada idi. Abdulla xan təvəkkül üzünü kömək edənlərin ən yaxşısının (Allahın) bargahına tutub, peyğəmbərlərin sonuncusuna (Məhəmməd peyğəmbərə) yalvarıb-yaxararaq sərsər küləyi (badi-sərsər) kimi o qoşun dəryasının üstünə getdi. İki dəstə bir-birinə yaxınlaşıb qarşı-qarşıya gəldilər, sağ (meymənə) və sol (meysərə) cinahların tərtibi ilə məşğul oldular. Qasım bəy çoxlu süvarilərdən və adlı-sanlı yeniçərilərdən [ibarət] on minlik[2436] qoşunla döyüşə və vuruşa hazır oldu. Yanında iki min süvari olan Abdulla xan onlara həmlə etdi. Qazilərin dövlət günəşinin yüksəlişi vaxtı olan çaşt çağının başlanğıcından ta o bədkirdar zalımların nəhs taleli ulduzlarının batması vaxtı olan iki namaz arasındakı zamana[2437] qədər aramsız çarpışma və ardıcıl şiddət dayanmadı. O yaramaz zümrədən min beş yüz nəfər dövran igidi savaş meydanında həlak torpağına düşdü. Ürək deşən oxun və şimşək [kimi] çaxan tüfəng gülləsinin gəliş-gedişi əsnasında xanın adamlarının ordugahda qalmış nökərləri külək rəftarlı atlara süvar olub, səf bağlayıb köməyə gəldilər. Şirvanlıların gözü onlara düşdükdə zənn etdilər ki, şah tərəfindən kömək yetişmişdir və [bu səbəbdən] qaçıb-dağılışdılar.

Nəzm

"Dağ nə qədər möhkəm (sabitqədəm) olsa da,
Qiyamət gəldiyi zaman başdan-ayağa dağılar".

Qorxudan saralmış rənglə və bədbəxtlikdən qaralmış üzlə puç halda Təbərsəran tərəfə qaçdılar. Qazilər onları təqib edib, bir dəstəsini qətlə yetirərək onların başlarından minarələr düzəltdilər.

---

[2433] *Qurani-Kərim, "Rəd" surəsi, 18-ci ayə.*

[2434] Nüsxələrin hamısında yeri boş saxlanıb.

[2435] Təngə – indiki Quba rayonunda, Vəlvələ çayının Yan silsiləsini kəsdiyi yerdə, təqr. 750 m. hündürlükdə yerləşən dar dərədir. Afruca kəndi yaxınlığındadır *(ASE, IX c., s.252).*

[2436] Baroda nəşri: "iki minlik".

[2437] Burada, yəqin ki, iki axşam namazı (şam və işa) namazları arasındakı vaxt nəzərdə tutulmuşdur. İsgəndər bəy Münşi də bu döyüşün axşam vaxtı sona çatdığını bildirir *(Tarixi-aləmarayi-Abbasi, I c., Bakı, 2009, s.187).*

### Müxtəlif əhvalatlar

Bu il dinin pənahı olan şah qonşuluğa riayət etmək və mülayimlik, vəfadarlıq izhar etmək üçün Fərruxzad bəy Eşikağasını məhəbbət üslublu bir məktubla və olduqca könül rahatlayan, rəğbət doğuran bir elçilik [missiyası] ilə Rum padşahı Sultan Süleymana göndərdi, anlaşma və uzlaşma bağlanmasının təməlini qoydu.

Həmçinin bu il Osman paşa, Sürxab Kürdü [cəzalandırmaq] məqsədi ilə Şəhrizura gəldi. Sürxab Kürd döyüşmədən vilayəti buraxıb Mərivana gəldi. Rumilər o diyarı istila etdilər.

### Ölümlər

Hind vilayətinin valisi Süleyman şah ibn Şirxan Əfqan[2438] bu il fani qəm dünyasından əbədi nemət [aləminə] köçdü və Hindistanın müxtəlif tərəflərində hərc-mərclik yayıldı. Cahillərin zərərini dəf etməklə məşğul ola bilən bir hökmükeçən padşahın yoxluğundan, "Əgər sultan olmasaydı, insanlar bir-birilərini yeyərdilər" buyruğunun sirri zahir oldu. Eyş-işrət qapıları o vilayətin əhalisinin üzünə bağlandı. Fəna dəryasının dalğaları ta Əxzər dənizinə çatdı. Fitnə və bəla dəstələri ətrafda və yan-yörədə meydana çıxdılar. Heç bir gül kolunda bir gül, heç bir budaqda bir bülbül və heç bir camda bir şərab qalmadı. Rahatlıq kaman kirişi kimi bir guşəyə çəkildi və qarışıqlıq mərkəz nöqtə kimi ortaya gəldi.

Nəzm

"Aqil haraya getsin axı, cahan zülm məkanına döndü,
Bal arısı harada şirinlik axtarsın axı, otlar xalis zəhər oldu.
Hadisənin tufanından göz yaşı seli yarandı,
Qanlı su qübbə-qübbə[2439] köpük kimi qabardı.
Fələklərə müsibət palazı libas oldu,
Səyyarələr üçün zülmət qoruyucusu hicab oldu".

Həmçinin bu il Gücərat valisi Sultan Mahmud[2440] axirət aləminə yollandı.

Yenə bu il Dəkən hökmdarı Nizamülmülk[2441] o biri dünyaya yollandı. Mövlana Qasım Kahi[2442] həmin hadisə haqqında [belə] deyir:

Şeir

"Üç xosrovun (hökmdarın) əcəli gəldi bu ildə,
Hindistan onların ədalətindən əmin-amanlıq diyarı idi.
Biri Gücərat şahənşahı Mahmud,
O, öz dövləti kimi növcavan idi.
İkincisi Dehli sultanı İslam şah,
O, Hindistanda sahib-qiran idi.
Üçüncü gəldi [əcəli] Nizamülmülk Bəhrinin,
O, Dəkən mülkündə Xosrov nişanlı idi.
Məndən o üç xosrovun vəfat tarixini soruşsan,
[Deyərəm ki], "xosrovların zavalı" oldu"[2443].

Öz zamanının şairlərinin ümdəsi olan və mədhiyyə demək sahəsində öncüllük topunu həmkarlarından və tay-tuşlarından irəli aparan Mövlana Heyrəti bu il Kaşanda bir köşkdən yıxılıb ömür vərəqlərinin dəftərini fəna küləyinə verdi. Mənzum əsərlərindən qəsidələri, qəzəllər divanı, "Behcətül-mübahic" ("Sevinclər

[2438] Ç.N.Seddon hesab edir ki, bu, Süleyman şah deyil, İslam şah olmalıdır. O, h. 952-ci (1545) ildə atası Şir şahın ölümündən sonra hakimiyyətə gəlmiş və 9 il hökmranlıq etmişdir *(Seddon, şərhlər, s.280).*

[2439] Baroda nəşri: "get-gedə".

[2440] Gücərat hökmdarı III Mahmud şah h. 944-cü (1537) ildən etibarən hakimiyyətdə idi *(Seddon, şərhlər, s.280).*

[2441] H. 914-961-ci (1508-1553) illərdə Dəkən yarımadasındakı Nizamşahlar sülaləsinin hökmdarı olmuş və tarixdə I Bürhan adı ilə tanınmışdır. Nizamşahlar sülaləsi həm də Bəhri adı ilə məşhur idi *(Seddon, şərhlər, s.280; Nəvai, şərhlər, s.1381).*

[2442] Şair Mövlana Qasım Kahi Səmərqənd seyidlərindəndir. Əsl adı Nəcməddin Məhəmməd, künyəsi Əbül-Qasımdır. 15 yaşında şair Caminin xidmətinə daxil olmuş, daha sonra Hindistana gedərək orada məskunlaşmış, Böyük Moğolların sarayında çalışmışdır. 110 il ömür sürdüyü deyilir. Şairliklə yanaşı, həm də idmançı və musiqiçi imiş *(Seddon, şərhlər, s.281).*

[2443] "Zəvali-xosrovan" ("xosrovların zavalı") = 961 h.

sevinci”) [əsəri] və Xoca Salman Savəcinin qəsidəsinin cavabında dediyi süni qəsidəsi vardır. Qəzvinlilərdən şikayət edib bir neçə beyt yazmışdır:

Nəzm

“Vaxt gəlib çatdı ki, təməlsiz asiman rahat olsun,
Zəmin kimi sənin kölgəndə, ey Pərvərdigarın kölgəsi!
Ey padşah, doqquz aydır ki, bu aciz,
Qalıb Qəzvində xarab, xəstə, yaralı və ağlar.
Həm aşağı, həm yuxarı təbəqəli insanlarda sünnilik aşkarlamışam,
Kiçiklərdə və böyüklərdə xaricilik əlamətləri görmüşəm.
Yoxsullar və varlılar məqbərələrdə ayaq yuyurlar,
Məscidlərdə əllərini bağlayırlar sağdan və soldan[2444].
Sənin kimi bir şahın zamanında namazda əl bağlamaq,
Zəbun adamın işi ola bilər, ey ali mənşəli şah!
Bu mülkün qazısı Xalid ibn əl-Vəlidin[2445] nəslindəndir,
Bu şəhərin müftisi[2446] mərdimazar Səidin övladıdır.
Hər ikisi qazi şahın qılıncı ilə öldürülsün,
Həm qardaşı, həm atası, həm dostu, həm qohumu, həm nəsli.
Ey bilikli şah, özün hökm et ki, indi bu güruh,
Düşmənin duaçısıdırlar, yoxsa şahın dostudurlar?!
Hamısını qırmasan da, heç olmasa bəzilərini qətl et,
Bu işə Həzrət Pərvərdigar da razı olar.
Axı bunlar rəiyyət deyillər ki, onları qətlə yetirmək,
Dövlət malının və diyarın vergisinin azalmasına səbəb olsun.
Bəlkə, hər biri divan malından bir məbləğ yeyir,
Başdan-başa soyurğal sahibidirlər və təqaüd alırlar”.

## 962-Cİ İLDƏ (26.11.1554 – 15.11.1555) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın üzüqara Abanın üzərinə ordu göndərməsi haqqında söhbət

Bu il xəbər gəldi ki, Aba Türkmən tüğyan gəmisinə minib, qan tökmək fikrinə və fitnə salmaq iddiasına malikdir və öz xəyal lövhəsinə qeyri-mümkün bir surət çəkmişdir. Ona görə də dinin pənahı olan şah, Gögcə sultan Qacarı və Əli sultan Tatıoğlu Zülqədəri cövşən geyən bahadırlardan [ibarət] bir dəstə ilə Astarabada yolladı. Onlar Çərəndab sultan Şamlu və Mustafa bəy Varsaqla birlikdə yaka türkmənlərinin məskəninə tərəf sürətlə yürüdülər və onların ev-eşiklərini tutub istila bayrağını yüksəltdilər. Neçə gündən sonra Aba Türkmən tamam qələbəliklə Çərəndab sultan Şamlunun və Mustafa bəy Varsağın ordusunun kənarına gəlib şeypur çaldırdı. Varsaq qaziləri və həqiqi dilavərlər əsla öz hallarını pozmadılar və düşmənləri ox və tüfəng zərbəsi ilə məğlub etdilər.

Bu əsnada Seyf bəy Bayat qaravulluq etmək üçün Gögcə sultanın ordusundan çıxmışdı. Aba Türkmən ona çatıb xeyli döyüşdən sonra onu əsir tutdu. Gögcə sultan və b. böyük əmirlər sürətlə o mərdimazarın arxasınca getdilər. Aba Türkmən qazilərin qılıncının qorxusundan atəş ayaqlı olub, torpağın büsatını külək kimi qət edərək Xarəzm valisi Əli sultan Özbəyin yanına getdi və ondan yardım istədi. Əli sultan bol qoşunla əmirlərin üzərinə hərəkət etdi. O iki döyüşkən ordu bir-birinə yaxınlaşdıqda, Əli sultan Özbək düşmənçiliyi tərk edib əmirlərin yanına [hədiyyə kimi] bir neçə at göndərdi və dostluğunu izhar etdi. Onlar da onun mülaziminə xələt verib Əli sultanın yanına yolladılar. Sülhdən sonra Gögcə sultan Qacar hərəkət bayrağını axirət aləminə tərəf yüksəltdi (vəfat etdi) və digər əmirlərin hər biri öz diyarına yola düşdü.

---

[2444] Şiələrdən fərqli olaraq, sünnilər dəstəmaz alarkən ayaqlarını yuyur və namaz qılarkən əllərini bir-birinə birləşdirmiş vəziyyətdə dayanırlar.

[2445] Şiələrin sevmədikləri və zalım hesab etdikləri bir səhabədir.

[2446] Müfti – şəriət əsasında fitva verən yüksək vəzifəli ruhani.

**Hümayun padşahın Sultan İsgəndərlə müharibə etməsi haqqında söhbət**[2447]

Elə ki Hindistan vilayətindəki qarışıqlığın və əfqan camaatının pərişanlığının [xəbəri] Hümayun padşaha çatdı, yağışların damlalarından artıq və saya-hesaba sığmayan bir ordu ilə o diyarda hakimiyyət və iqtidarı [ələ keçirmək] məqsədi ilə oraya hərəkət etdi. Cağatay ordusu Maxurə[2448] çayı kənarında Hüseyn xan və Fəth xanla böyük bir hərb etdi. Əfqanlar məğlubiyyətə uğradılar və onların qoşununun sıraları pərən-pərən oldu. Bəziləri Dehli hakimi olmuş Sultan İsgəndərə pənah apardılar və bəziləri dağlara gedib qoşun toplamaq məqamında dayandılar.

Hümayun padşah bir sıra dövlətsevər əmirlərlə birlikdə səf bağlayıb Dehliyə yollandı. Elə ki Sultan İsgəndər zəfər nişanlı qoşunun hərəkətindən xəbərdar oldu, sonsuz bir ordu və tamam şövkət ilə Sərhində yollandı. O, öz ordugahının çevrəsində xəndək qazdırdı. Hümayun padşah məiyyət və ordu ilə onların yaxınlığında, bir zərbzən atışı məsafəsində dayandı. O tərəfdən, Sultan İsgəndər öz ordusunu tərtib etmiş və könlünü qorxaqlıq və cəsarətsizliklə bəzəmişdi. Dağ təməlli, bulud xilqətli, asiman görkəmli, ildırım heybətli və şimşək şiddətli fillərə kəcim[2449] geyindirib və onların xortumlarını zirehə tutub qarğa çöhrəli hindliləri ox atmaq üçün onlara süvar etmişdi.

Beyt

“İri fillərin üstündə oturmuşdu ox atanlar,
Atəş saçan ifritlər kül təpələri üstündə oturduqları kimi”.

Asiman tozanaqdan yer kimi torpaq rənginə büründü və yer polad geyimlilərdən cövşən rəngli buludun libasını geydi.

Beyt

“Tozanaqdan asiman qaraldı,
Cövşənlər səbəbindən yer balığın belinə oturdu”.

Hümayunun bayraqları yüksəldi. Döyüş şəkli və vuruş surəti aşkar oldu. İlk öncə padşahın oğlu Cəlaləddin Məhəmməd Əkbər, Bayram xan, Şah Əbül-Məali, Tərdi bəy və Bahadır sultan bir dəstə igidlə düşmənlərə həmlə etdilər və döyüş atəşini alovlandırdılar. Qana bələnmiş xəstə bədəndən oxun başı ləl rəngini aldı və nizənin ucu qızılı çöhrənin əksindən kəhrəba sarılığı əldə etdi.

Beyt

“Ölülərin [çoxluğundan] çöldə yol görünmürdü,
Hava zəncinin üzü kimi qara olmuşdu”.

Qoşun igidləri, səf yaran bahadırlar və dilavər kişilər İsgəndərin düzəltdirdiyi xəndək və çəpərdən keçdilər, iti qılıncın və can odlayan oxun yarası ilə o külbaş sərgədranların həyat damarını qopardılar.

Şeir

“Heç yarım gündən artıq vaxt keçməmişdi ki,
Qaralar üç cür bədbəxt oldular.
Hər tərəfdə bir bədbəxt hindli yerə sərilmişdi,
Biri başsız düşüb qalmışdı, biri ayaqsız və biri əlsiz.
Bədəndən getdi qan, gül ilə qarışdı,
Qara tuluq kimi ondan badə töküldü”.

Sultan İsgəndər çoxlu qoşununun, şövkətli iri fillərinin mövcudluğuna görə məğrur idi və “Məgər Misir səltənəti, altımdan (saraylarımın altından) axıb gedən bu çaylar mənim deyilmi?!”[2450] [ayəsində Fironun dilindən deyildiyi kimi] beyninə lovğalıq yol tapmışdı. O, “Məgər Rəbbinin fil sahiblərinə (Kəbəni dağıtmaq üçün fillərlə Məkkənin üstünə gələn həbəş ordusuna) nələr etdiyini görmədinmi?! Məgər (Rəbbin)

---

[2447] Məclis nüsxəsi: “962-ci il hadisələrinin haqqında söhbət və dinin pənahı olan şahın əmirləri Torali üzərinə göndərməsi, Hümayun padşah cənablarının Sultan İsgəndərlə müharibə etməsi haqqında”.

[2448] Nuruosmaniyyə nüsxəsi: “Maxvarə”; Məclis nüsxəsi: “Mamurə”.

[2449] Kəcim (kəcin) – döyüş günü atlara geyindirilən xüsusi bir geyim növüdür (bax: *M.Müin. Fərhəngi-farsi, III c., s.2916*).

[2450] *Qurani-Kərim, “Zuxruf” surəsi, 51-ci ayə.*

onların hiyləsini boşa çıxartmadımı?!”[2451] məzmunundan xəbərsiz qalmışdı. İndi qorxudan onların çöhrəsi kəhrəbayi oldu və saman sərt küləyin həmləsindən sovrulduğu kimi, təfriqəyə düşüb qaçdılar.

Nəzm

“Hindlilərin hamısının sinəsi yaralı oldu,
Ənbər qoxan zülf kimi pərişan oldular.
Arzu-istək ətri çıxıb getdi, bəxt üz döndərdi,
O taxt-tacdan ancaq qan bahası qaldı”.

Cağatay qoşunu onları qovub bir çoxlarını gedər-gəlməzə göndərdi və bəzilərini əsir edib Hümayunun dərgahına gətirdilər.

Beyt

“Hindlilərin hamısı moğollara əsir oldular,
Onların boynuna buxov taxdılar”.

Ertəsi gün Hümayun padşah döyüş meydanından köçüb Dehliyə yollandı və Hind şəhərlərini zəbt etdi.

**Müxtəlif əhvalatlar**

Bu il dinin pənahı olan şah Qarabağdan köçüb darüssəltənə Təbrizdə cah-calalla dayandı. O həzrət buyurdu ki, havasının mülayimliyi, zövq verən fəzası, ağaclarının lətifliyi, gülzarının təravəti və rəvan suları ilə “Onlar üçün içindən çaylar axan cənnətlər vardır” [ayəsində deyildiyi kimi] son dərəcə şöhrət qazanmış Şimal bağında şahanə ziyafət və xosrovanə məclis tərib etsinlər.

Nəzm

“Elə bir bağdır ki, İrəm bağı ona həsəd aparır,
Onun atəşin gülü İrəm çırağıdır.
Çinarı qəddini yüksəldib yerdən,
Vurub pəncə uca göyün gövdəsinə.
Gülşəninin fidanı ədalı gözəllər kimi,
Dırnaqlarının hamısını həna ilə rəngləyib.
Gözəllərin zülfü kimi, yaşıllığı ürək oxşayır,
Səba yeli orada sərgərdan olub.
Süsən və qönçələri bir-birinə qarışıb,
Orada ürəklər rahatlıq tapır.
Sərv ağaclarının hamısı qəlbə xoş gəlir,
Uca rəna yaşıllıqlar kimidirlər, hündürdürlər.
Elə ki başlayar orada bülbüllər nəvaya,
Göyərçin oynamağa başlar havada”.

Fərmana əsasən, çevik fərraşlar qübbə və bargah dəstini (çadırları) günəşə və aya yüksəltdilər.

Beyt

“Cənnət kimi bir bargahı asimana doğru,
Çəkdilər ta ayla günəşin zirvəsinə qədər”.

Dinin pənahı olan şah bargahda qərar tutdu. Xoş avazlı mütrüblər və çəng çalan musiqiçilər o məclisdə şahanə nəva, Davudi səda[2452] və avazlı əda ilə [mahnı səsləndirdilər], qanun (kanon) və bərbət[2453] səsindən fələkdə mələk rəqsə gəldi.

Şeir

“Bakirə Məryəm kimi bağlı qalmış bərbət,
Sanki doğuş sancısından naləyə, zara gəldi.

---

[2451] *Qurani-Kərim, “Fil” surəsi, 1 və 2-ci ayələr.*

[2452] Dini mənbələrə görə, Davud peyğəmbərin çox gur və məlahətli səsi varmış. “Davudi səda” ifadəsi də gözəl səsi ifadə etmək üçün işlədilmişdir.

[2453] Simli musiqi alətidir.

Qarın deşən ilana və arsız ovsunçuya bənzəyən,
Şirin sulu budaq (nəfəsli çalğı aləti) yar ilə dodaq-dodağa gəldi.
Rübab nalandır mey eşqindən, sinəyə bağlanmışdır əli onun,
Bazusu üstündə yuxarıya doğru çoxlu damarlar varıdır".

Və qohum-əqrəbadan bir qızı[2454] aləm sakinlərinin şahzadəsi İsmayıl mirzə ilə nikahladılar və zifaf təşkil etdilər. Tale süfrəçiləri yer üzünün şəbistan məclisini [işıqlandırmaq] üçün ay və günəş girdəsini fələyin tabaqlarına qoyduqları zamandan etibarən belə bir yaxşı məclis və bu cür yeməklər görməmişdilər. Bu zifafın tarixi haqqında bu iki misra vaqe olmuşdur:

"Günəşlə ayın vüslətini verdi fələk (Vüsləti-mehrü-mah dad fələk) = 962".
"Fələk peyvənd etdi günəşlə ayı (Fələk dade peyvəndi-şəmsü-qəmər) = 962".

Elə ki qışın ön dəstəsi və soyuğun qoşununun həmləsi yay və payız səhra-nişinlərinə (səhra sakinlərinə) əl uzatdı, əsən külək xəzan yarpaqlarına təsir etdi və onları tökdü:

Nəzm

"Xəzan elə ki gəldi bağı tarac etməyə,
Xəzan küləyindən öldü bağın gülzarı.
Bənövşə öz qəddini bükdü,
Soyuqdan nilin (indiqonun) üzünə matəm çəkildi.
Xəzan laləyə o qədər zülm etdi ki,
Tökdü başından tacını və dad etdi.
Düşdü gül murad fidanından,
Verdı həyat xırmanını küləyə.
Belə bir fəsildə iqlim (ölkə) bəxş edən şah,
Qəzvinə doğru çapdı öz atını".

Həmçinin bu il İbrahim xan Zülqədər rəbiüləvvəl [ayının] 14-də[2455] (06.02.1555) [şahın] qəzəbinə düçar oldu. Şiraz hakimliyi Əli sultan Tatıoğluya verildi[2456].

**Ölümlər**

Hümayun padşah ibn Babur padşah ibn Ömərşeyx ibn Sultan Əbu-Səid ibn Mirzə Sultan Məhəmməd ibn Mirzə Miranşah ibn Sahibqiran Əmir Teymur Kürəkan bu il dünyadan köçdü. Ölümünün səbəbi odur ki, Dehli şəhərində bir damın başına çıxmışdı və əsaya söykənib əmirlərlə söhbət edirdi. Elə bu dəm, qəflətən yersiz yuxu o ali məkanlı padşaha qələbə çaldı, əsası qırıldı və padşah tam zərblə damdan aşağı yıxıldı[2457]. Dərhal axirət aləminə yollandı.

Şeir

"Heyif olsun cavanlıq gündüzünün günəşinə,
Yuxarıdan düşdü bu bəla qəflətən.
Həsrətlə getdi cahandan alicənab,
Vardı onun can iqlimində qəhrəmanlıq.
Heyif belə bir iqtidar sahibindən ki,
Qəflətən onun arzuları qırıldı.
Tabutdan düzəltdi əcəl bir təxtbənd,
Onun uca sərvə bənzər pəhləvan qaməti üçün".

[2454] Bu qız, şiə yönümlü Nemətullahi sufi təriqətinin başçısı olan Şah Nemətulla Yəzdinin Şah Təhmasibin bacısı Xanış xanımla nikahından doğmuşuldu və İsmayıl mirzənin bibisi qızı idi *(Nəvai, şərhlər, s.1388).*

[2455] Bakı nüsxəsində ayın tarixi yoxdur.

[2456] Məclis nüsxəsi: "Rəbiüləvvəl [ayının] 14-də dinin pənahı olan şahın İbrahim xan Zülqədərə qəzəbi tutdu. Çünki o, öz vəziri Mirzə İnayətin xatirinə, o zaman Şiraz kələntəri vəzifəsini daşıyan, adları çəkilən xanın və vəzirinin bütün sərvətini dürüst saxlayan Əmir Seyid Şəhriyar Cührümini tutaraq gözünü çıxartmışdı. Şah ondan üz döndərib onu həbs etdi və mallarını "sərkari-xasseyi-şərifə" üçün zəbt etdi".

[2457] Bundan sonra Məclis nüsxəsində yazılmışdır: "Ertəsi gün Cəlaləddin Məhəmməd Əkbəri öz yerinə təyin etdikdən, Bayram xan Baharlunu lələ və vəkil qoyduqdan və vəsiyyətlər etdikdən sonra dünyadan köçdü".

O həzrət şövkət sahibi olan bir padşah və hikmətə can atan bir hökmdar idi. Təbiətinə xas olan adətin lüzumuna görə, bəlkə də, əbədi səadət zərurətinə əsasən, həmişə fəzilət və elm-sənət sahiblərinə, fəzilət yayan istedadlılara ucsuz-bucaqsız ehtiram göstərərdi, tam cidd-cəhdlə qabiliyyət sahiblərini [öz sarayına] toplamağa çalışardı və onun bəxşişi iki yüz tümənə bərabər olan bir lək məbləğindən az olmazdı.

Nəzm

“Onun dərgahına pənah gətirən hər kəsin,
Ehtiyacı təmin olunardı.
Hansı binəvaya nəzər saldısa,
Onu gövhərlə qane etdi.
Elm-sənət əhlindən yanına kim gəldisə,
Saldı kərəm kölgəsini başına”.

Səltənət müddəti iyirmi altı il olmuş, məmləkəti Qəndəhardan ta Hindistanın ortasınadək uzanmışdır. Mövlana Qasım Kahi onun [ölüm] hadisəsinin tarixi haqqında demişdir:

Nəzm

“Məna mülkünün padşahı Hümayun,
Heç kim ona tay bir şahənşah xatırlamır.
Öz qəsrinin damından düşdü qəflətən,
Və əziz ömrü getdi fəna küləyinə.
Onun tarixi haqqında Kahi yazdı:
Hümayun padşah damdan düşdü”[2458].

Onun ölümündən sonra böyük oğlu Cəlaləddin Məhəmməd Əkbər Aqrada səltənətə əyləşdi. Digər oğlu Məhəmməd Həkim mirzə Kabildə oturdu. Bayram xan Baharlu cəmi işləri öhdəsinə götürdü. Cəlaləddin Məhəmməd Əkbərin quru padşah adından başqa heç nəyi yox idi.

Xoca Cəlaləddin Mahmud zəmanə alimlərinin öndəgedəni və dövran bəlağətlilərinin ən fəsahətlisi idi. Növbənöv fəzilətlərinin və kamilliklərinin mövcudluğuna baxmayaraq, həmin yaxşı xüsusiyyətli alim özözlüyündə təkəbbür və lovğalıq düşüncəsinə qapılmamışdı. O cənab, Mövlana Cəlaləddin Məhəmməd Dəvaninin yanında təhsil almışdı. Bu il o, cahanın möhnətli sarayından cənnət bağına getdi. Əsərləri sırasından Mövlana Cəlaləddinin müqabilində yazdığı “İsbati-vacib” (“Vacib olanın isbatı” və ya “Vacib isbat”) [adlı əsəri] vardır.

## 963-CÜ İLDƏ (16.11.1555 – 03.11.1556) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Şahverdi sultan Ziyadoğlunun Ləvasan[2459] Gürcü ilə vuruşması

Bu il Ləvasan Gürcü Qoridən çıxıb, Kuməş[2460] qalası ətrafına gəldi. Elə ki Şahverdi sultan Ziyadoğluya xəbər çatdı, Qarabağ ordusunu toplayıb onların üzərinə yollandı. Kafirlərin məskənlərinin yaxınlığına yetişdikdə xəbər gəldi ki, Ləvasan *(Luarsab) fərar etmişdir. Qazilərin hamısı birdən düşmənlərin ardınca at çapdılar. Belə ki, Şahverdi sultan Ziyadoğlunun yanında əlli nəfərdən artıq adam qalmadı. O tərəfdən isə*[2461] qazilərin təsəvvürünün əksinə olaraq, Ləvasan aznavurlardan [ibarət] çoxsaylı bir dəstə ilə bir təpəyə qalxıb savaşın intizarını çəkməkdədir. Bu tərəfdən dilavərlər tam qürur və təəccüblə o məkana çatdılar. Tale bələdçisi Ləvasanı döyüş meydanına doğru hərəkətə gətirdi və o, öz hərəkət yüyənini başsız qazilərə tərəf yönəltdi. Dilavərlər mərdlik və mərdanəlik nümayiş etdirdikdən sonra məğlub oldular və Şahverdi sultan da qaçış yolunu tutdu. Kafirlər ordusu mülazimlərdən və adlı-sanlı bahadırlardan üç yüz nəfəri qətlə yetirdi. Onların əksəri qazilərin ardınca getdi. Ləvasan bir keşişlə[2462] o məkanda qaldı. O əsnada Məhəmməd bəy Çepni[2463]

---

[2458] “Hümayun padişah əz bam oftad” = 962 h.

[2459] Bakı nüsxəsi: “Luarsab”. Ə.Nəvainin qeydi (s.1391): “Nüsxələrin hər yerində belə (yəni Ləvasan və ya Lüvasan– N.M.) yazılsa da, səhih olan Luarsabdır”.

[2460] Bu yerin adı gürcü mənbələrində Qaris və ya Qaris-Varxuna kimi yazılmışdır *(П.Горгиджанидзе. История Грузии, с.35; «Парижская хроника». Перевел с грузинского Г.Г.Аласаниа. Тбилиси, 1991, 30).*

[2461] Bakı nüsxəsi (230b).

[2462] Bakı nüsxəsi: “keşişlərlə”.

bir neçə qafildən [ibarət] məhdud bir dəstə ilə Ləvasana rast gəldi və çəkinmədən həmlə etdi. Şahın səadəti ona yar oldu və Ləvasanın atı büdrədi. Ləvasan atdan yıxıldı. Məhəmməd bəyin mülazimlərindən olan Zakir adlı birisi[2464] [atdan] enib ona bir neçə yara vurdu. O əsnada gavurlar ona hücum etdilər. Məhəmməd bəy, Ləvasanın atına minib aradan çıxdı. Gavurlar Zakiri bir neçə çepni ilə birlikdə şəhid etdilər[2465]. Şər və fəsadın sərmayəsi[2466], küfrün və üsyanın əsli olan Ləvasan qəmin dostu və peşmançılığın yoldaşı oldu. Onun şirk ələmləri və zəlalət bayraqları qəhr əli ilə başı aşağı endi. O, dava girdabında və hərb atəşində küləyin külü sovurduğu kimi sovruldu və canını Malikə (Allaha) tapşırdı.

Beyt

“Allah qiyamət gününün məclisində cəhənnəm manqalına,
Şahın düşmənlərindən üzərlik qoyar”.

Gavurlar Ləvasanın cəsədini götürüb öz diyarlarına yollandılar.

## Hind vilayətində baş vermiş hadisələr haqqında söhbət. Cəlaləddin Əkbərin Heymu Hindi ilə müharibə etməsi

Hümayun padşahın vəfat xəbəri Aqraya çatdıqda, Heymu adlı dövlətsiz bir kafir öz beynində istiqlal xəyalına yer verib, hər diyardan çoxlu adamlar toplayaraq hərəkət bayrağını Dehliyə tərəf yüksəltdi. Cəlaləddin Əkbər tərəfindən o şəhərin hakimi olan Tərdi bəy müqavimət göstərməyə tab gətirməyib fərar yolunu tutdu.

Bu möhnətli xəbər yüksək məqamlı padşaha çatdıqda fərman verdi ki, qoşun dəstələri Əxzər dənizi kimi hərəkətə gəlib bir-birinin ardınca yola çıxsınlar. Adlı-sanlı əmirlərdən Əliqulu xan Özbək və Bahadır sultan digər sərdarlarda [birlikdə] igidlik bayrağını yüksəldərək mənqəlay qaydasında düşmənlərin üzərinə hərəkət etdilər. Kama çatmış hökmdar zəfər şüarlı qoşunlarla [birgə] əmirlərin ardınca yola düşdü.

Beyt

“Tələsdi [onların] ardınca asiman kürsülü şah,
Necə ki, sübh parıltısının ardından günəş tələsər”.

Elə bu zaman qaravullar ali [hökmdarın] qulağına çatdırdılar ki, Heymu Hind sərhədinə çatmışdır. O həzrət meymənə və meysərəni tərtib edib yola düşdü. İki qoşun arasındakı məsafə daraldı. O iki sərdar bir-birinin qarşısında dayandılar. Elə ki şərqin xaqanı günəş həbəş (qaranlıq, zülmət) qoşunu üzərinə at çapdı, misri qılınc zərbəsi ilə onları məğlub etdi,

Nəzm

“Ertəsi gün kəhərini çıxardı günəş,
Yeyin atla rəvan oldu asimanın üzərinə”,

Cəlaləddin Əkbər padşah ordunu tərtib etməklə məşğul olub, ordunun meymənə və meysərəsini Bayram xan Baharlu, Tərdi bəy, Məhəmməd Qasım Nişapuri və Hüseynqulu Zülqədər[2467] kimi adlı-sanlı əmirlərə tapşıraraq Əliqulu xanla Bahadır sultanı çərxçı [təyin] etdi. O tərəfdən Heymu da hərb ləvazimatları və alətləri, vuruş və zərbə silahları və dörd yüz zəncirli fil ilə savaş meydanına üz qoydu. Fillər döyüş səhrasında dəniz küləkdən coşan kimi coşdular. Onların koramal şəkilli xortumları fələk aslanının boyunduruğuna çevrilmiş, Cövza məntəqəsi və Sürəyya halqası olmuşdu.

Şeir

“Səf yaran fillər dəstə-dəstə,
Belləri yumru təpələr və dağlar kimi.
Kirpikləri nizə kimi, gözləri əqiq kimi,
Xortumdan quyruğa qədər dəmirə qərq olmuşlar”.

---

[2463] Bakı nüsxəsi: “Məhəmməd bəy Zakiroğlu”.
[2464] Bakı nüsxəsi: “Məhəmməd bəyin mülazimlərindən biri”.
[2465] Bakı nüsxəsi: “Gavurlar qazilərdən bir neçə nəfəri qətlə yetirdilər”.
[2466] Məclis nüsxəsi: “xəmir mayası”.
[2467] Bakı nüsxəsi: “Əliqulu xan Zülqədər”.

Onların belində möhkəm taxtlar düzəltmişdilər. Heymu onlardan birinin üzərinə oturmuşdu. Hindlilər fillər səfinin böyründə igidlik atına minib möhkəm dayanmışdılar. İlk öncə Əliqulu xan və Bahadır sultan kafirlərə həmlə etdilər, ox və kamana, qılınc və nizəyə əl atdılar.

Nəzm

"Hər səmtdən kaman qarğasının avazından,
Qaçıb dağıldılar kərkəslər asimandan.
Yetərincə atəş saçan oxun atılmasından,
Qabar olub ox atanların əli.
Sinələr nizədən delik-deşik tora dönüb,
Pəhləvanlar bu dəliklərdən tamaşa edir".

İti qılınc hindlilərin qır kimi [qara] çöhrəsinə qırmızı niqab bağlayırdı və fillərin mavi gözündən qan çeşməsi fışqırırdı. Cağatay ordusunun bahadırları [özlərini] onların səfinə vurub filbanları (fil sürənləri) o külək rəftarlı dağların (fillərin) təpələrindən başı aşağı salırdılar. Döyüş və vuruş əsnasında bir ox mərdimazar Heymuya dəydi. O, yüz qəm və qüssə ilə cəhənnəmə vasil oldu. Ona görə də hindlilər fərar vadisinə üz çevirdilər. Müzəffər qoşunların bir dəstəsi o dinsiz kafirləri təqib edib, qaçanlara kin və intiqam qılıncı vururdular. Zəmanə zəlalət və şirk əhli üçün işıqlı gündüzü qaranlıq gecəyə çevirmişdi. Hind dikbaşları və dilavərləri yerlə yeksan oldular. Sanki fəna qılıncı hindlilərin mis [kimi qara] çöhrəsinə qızıl [qan] tökürdü və əcəl əli onların qır rəngli bədəninə zəfəran əkirdi.

Şeir

"Yetərincə hindli öldü, zəmin qara oldu,
Qarğalar kimi tökülüb qaldılar yolun üstündə.
Parlaq nizə bədəni yandırdı,
Atəşin odunu yandırdığı kimi".

Müzəffər və qalib Cəlaləddin Əkbər padşah o döyüş meydanında cah-calalla dayandı.

**Yüksək şanlı əmirlərin Qəndəharı mühasirə etməsi haqqında söhbət**

Elə ki Hümayun padşah Hind vilayətini ələ keçirdi, padşahın möhkəm dayağı olan Bayram xan Baharlu Qəndəharı Şah Məhəmməd Qəlatiyə verib padşahla birlikdə Hində yollandı. Ona görə də alicənab padşahın (Hümayunun) tərəfindən Zəmindavər hakimi olan Heydər xan Özbəyin oğlu Bahadır sultan qələbəlik qoşunlarla Qəndəharı mərkəz kimi mühasirəyə aldı. Şah Məhəmməd Qəlati dinin pənahı olan şahın hüzuruna yaxşı danışıq qabiliyyətinə malik elçilər göndərib yardım istədi. Bu səbəbdən hökmdar (Şah Təhmasib) fərman verdi ki, Bəhram mirzənin oğlu Sultan Hüseyn mirzə, Vəli xəlifə Şamlu və Danə bəy Əfşarın oğlu Allahqulu bəy çoxsaylı ordu ilə Qəndəhara yollansınlar.

O zaman Vəli xəlifə Şamlunun oğlu Şahverdi bəy bir dəstə adlı-sanlı bahadırla qəflətən Bahadır sultanın üzərinə həmlə etdi. Dava-dalaşdan sonra Bahadır sultan qaçmağa üz qoyub Hind diyarının yolunu tutdu. Amma Şah Məhəmməd Qəlati müxaliflik etməyə başlayıb qala darvazalarını ali soylu qazilərin üzünə bağladı. Müzəffər qoşunlar Qəndəharı üzük qaşı kimi dövrəyə aldılar. Təxminən üç ay ali məqamlı qazilər o azğın tayfa ilə mücadilə etdilər. Bir gün Şah Məhəmməd Qəlati yağış qədər ordu ilə qaladan Vəli xəlifənin üzərinə basqın etdi. O zaman həmin yüksək şanlı əmirin mülazimləri pərən-pərən düşdülər. Amma igidlik əhli olan bir dəstəsi sabitqədəmlik edib mərdanə səy göstərdilər. Hər iki tərəfdən çoxlu adam öldürüldü. O uğursuz güruh bir iş görə bilməyib qalaya qayıtdı. Hüseyn bəy Ayçəkoğlunun məsləhəti ilə zəfər şüarlı əsgərlər Qəndəharın ətrafından köç edib Xorasana yollandılar. Amma Vəli xəlifə Şamlu bəla əlamətli ordu ilə Zəmindavərə gəlib çoxlu döyüşdən sonra o qalanı ələ keçirdi.

## Müxtəlif əhvalatlar

Bu il dinin pənahı olan şah Herat hakimliyini aləm sakinlərinin şahzadəsi olan İsmayıl mirzə cənablarına həvalə etdi və Sultan Məhəmməd mirzəni [oradan] yanına çağırdı. [Şah] Dəryarək[2468] yaylağında məskən saldı.

Həmçinin bu il əmirlər və əyanlar bütün günahlardan tövbə etdilər. Bu qitə həmin hadisənin tarixi barəsində varid olubdur:

Qitə

"Din ölkəsinin sultanı adil Şah Təhmasib,
And verdi və din ordusunu etdi tövbəkar.
Tövbə vermək tarixi oldu "səmimi töbvə"[2469],
Bu bir İlahi sirdir, sən onu etmə inkar".

## Ölümlər

Büraq xan ibn Sevincək sultan ibn Əbülxeyr xan ibn Dövlətşeyx-oğlan ibn Fulad-oğlan ibn Aybə Xoca ibn Toğtay ibn Bolğay ibn Şeyban ibn Cuci ibn Çingiz xan, Səmərqəndi Əbu-Səid xanın övladından almış, Buxaranın ətraf vilayətini Übeyd xanın oğul nəvəsi Bürhan Səiddən qoparmış, indi Şahruxiyyə [adı] ilə məşhur olan Miyankal vilayətini Canibəy sultanın övladının ixtiyarından alıb zəbt etmiş və Fulad sultanın övladına aid Şəhri-Səbz və Qərşini onların əlindən tutub almışdı. Bunları etdikdən sonra o, belə bir iddiaya düşdü ki, Daşkəndlə Səmərqənd arasındakı Şahruxiyyə çayından bir arx götürüb onu Səmərqənd tərəfdə yerləşən geniş vadiyə axıtsın. Fikri bu idi ki, qışda Daşkəndlə Səmərqəndin arası qar səbəbindən bağlı olan zaman onun ulusunun adamlarından iyirmi min nəfər həmin səhrada qışlaq edib ona yaxın olsunlar. Təsadüfən, bu məqsədlə həmin səhraya getdi və gecə bal şərabı içib öz atalığının oğluna tamah saldı. Oğlan ona beş bıçaq [zərbəsi] vurub, elə həmin gecə fərar edərək Hisar (Hisari-Şadman) sultanlarının yanına getdi. Buraq xan o yaradan öldü. Ömrünün müddəti əlli altı il idi. Məmləkəti Daşkənd, Fərqanə, Səmərqənd və Buxaranın 2/3 hissəsi olmuşdur.

Onun ölümündən sonra böyük oğlu Dərviş sultan xan oldu. Qardaşları Baba sultan, Əmin sultan, Xarəzmşah sultan və b. ona tabe oldular. Buraq xanın ölüm xəbəri Kaşğara çatdıqda, o diyarın hakimi Rəşid xan öz ordusunu toplayıb Əndicana yola düşdü. Çünki Buraq xanın atası Sevincək sultan Rəşid xanın atasından [oranı] almışdı. Bürhan Səid də bir dəstə qoşunla Buxaranın cəmi nahiyələrini ələ keçirdi. Haqnəzər xan Qazax Qoruq[2470] və Qürba vilayətindən [çıxaraq] Daşkəndi [tutmaq] tamahı ilə hərəkətə keçdi.

Buraq xandan sonra sikkə və xütbə Canibəy sultanın oğlu Pir Məhəmməd xanın adına edildi. Az müddət sonra İsgəndər xanın tam yetkinliyə çatmış oğulları Abdulla xan[2471] və İbadulla xan taqətsizlik küncündə aram tapan, ayağını guşənişinlik dairəsindən kənara qoymayan və bir mərkəz kimi öz yerində qərar tutan atalarını padşahlığa yüksəltdilər. Pir Məhəmməd xan naçar halda sikkəni onun adına vurmalı oldu.

Mir Əsədulla Şüştəri adlı-sanlı seyidlərin fəzilətlilərindən, nəqiblərin və nəciblərin əzəmətlilərindən olub, ali səviyyəli alimlərdən idi. O, əqli və nəqli elmləri özündə cəmləşdirmiş, insani fəzilətləri və kamillikləri şəxsində toplamışdı. O həzrətin doğum yeri Şüştərdir. Amma əksər vaxtlarda müqəddəs şəhidgahlarda (məşahidi-müqəddəsə)[2472] dini elmləri ifadə etməklə və yəqinlik maarifindən istifadə etməklə məşğul olardı. Zəmanə müctəhidinin (Şeyx Əli ibn Əbdüləalinin) hüzurunda Ətəbati-Aliyatda[2473] nəqli elmləri öyrənmiş və tam tərəqqi əldə etmiş adamların arasında ən fəzilətlisi və ən biliklisi sədarət vəzifəsini tutmuş sözügedən şəxsdir (Mir Əsədulla Şüştəridir). Bu səbəbdən zəmanə müctəhidi olan həzrət həmişə behişt ayinli məclisdə onun ləyaqətlərini, fəzilətlərini və kamilliklərini izhar edirdi. Elə ki Müizzəddin Məhəmməd [sədarətdən] çı-

---

2468 Bakı nüsxəsi: "Dəryavək".

2469 "Tövbətən-nəsuhən" ("Səmimi tövbə") = 963 h. Bu ifadə "Qurani-Kərim"in "Təhrim" surəsinin 8-ci ayəsindən götürülüb: "Allaha səmimi-qəlbdən tövbə edin".

2470 Məclis nüsxəsi: "Fərəh".

2471 Məclis nüsxəsi: "Abdulla sultan".

2472 Baroda çapında "məşahid" yerinə "Məşhəd" yazılmışdır.

2473 Ətəbati-aliyat – hərfi mənası "uca astanalar" deməkdir. Bu ad altında şiə imamlarının İraqdakı məqbərələri nəzərdə tutulur.

xarıldı, üzəngisi asiman olan hökmdar sədarəti icra etməyə layiq olan bir sıra şəxslər barəsində fəzilətli insanlar və qüdrətli dövlət ərkanı ilə məşvərət təşkil etdi. Hər kəs öz müddəasına uyğun gələn bir kimsənin namizədliyini irəli sürdü. Lakin şərəfli hökmdar onun (Mir Əsədulla Şüştərinin) vəsflərini zəmanə müctəhidinin dilindən eşitdiyi üçün məhz o həzrəti [sədarət mənsəbinə] təyin etmək haqqında qərar verdi, onun hüzuruna Şüştərə adam göndərib onu ulu dərgaha çağırdı və sədarət mənsəbini ona həvalə etdi. Doğrudan da, onun dünyəvi və mənəvi kamillikləri saysız-hesabsız idi. Gözəl ibarələr və lətif inşa onun öz fəzilətləri üzərinə əlavə etdiyi xüsusiyyətlərdən idi. Əksər elmlər haqqında əsərləri vardır. O cümlədən Ətəbati-Aliyatda zəmanə müctəhidi olan həzrətin xidmətində olan vaxt o həzrətin ali işarəsinə əsasən, onun müəllifi olduğu əsərlərdən "Risaleyi-əlfiyyə"ni ("Əlfiyyə risaləsi"ni) ən fəsahətli ibarələr və ən lətif istiarələrlə tərcümə etmişdir. Həmçinin əmr sahibinin (Mehdi Sahibüzzamanın) – ona dua və salam olsun – zühuru haqqında bir risalə yazmış, ona "Cilaül-üyun" ("Gözlərin cilası") adını qoymuş və [orada] o həzrətin mövcudluğu barəsində nəqli və əqli dəlilləri təqdim etmişdir. Bu il [Mir Əsədulla Şüştəri] dünyadan köçdü.

## 964-CÜ İLDƏ (04.11.1556 – 23.10.1557) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Təbrizə getməsi və Qazı Məhəmmədlə Heydər bəy Ənisin dustaq edilməsi

Elə ki soyuğun qoşunu bahar ordusunun ön dəstəsinə məğlub olub qaçmağa üz qoydu, o fəslin gəlişi ilə gündüz həyat təbiətini əldə etdi.

Nəzm

"Elə ki dey (qış) getdi və ordibehişt (bahar) fəsli oldu,
Yasəmən tənə vurdu behişt bağına.
Fələyi bürüdü bulud sayəbanı,
Onun şimşəyi hər guşədə zərli kəndirə bənzədi".

Bahar fəslinin əvvəllərində kama çatmış şah Qəzvindən çıxıb Səhənd yaylağına yollandı. Müsafir oğlu Qazı Məhəmməd ixtiyar yüyənini tamahkar nəfsinin əlinə vermiş, zülmkarlıq kürsüsünə əyləşmiş, şəhvət atını hər tərəfə çapmış, kobudluğu özünə şüar etmiş, türkü və taciki incitmiş və narahat etmişdi.

Nəzm

"Kobudluq itidir, tikan koluna bənzər,
Əclafın fikri və əməli sağalmaz yara kimidir.
Bu, paxıllıq və həsəd kimi düşmənçiliyin mayasıdır,
Acgözlük və tamah kimi xoşagəlməzdir".

Hökmdar fərman verdi ki, onu həbs etsinlər. Mövlana Seyrəfi həmin hadisənin tarixi haqqında [belə] deyir:

Nəzm

"Firon kimilərin başçısı Qazı Məhəmməd,
Zülm Misirinin banisi idi o.
Əgər həmin yaramaz iki il də qalsa idi,
Onun tarixi "Fironi-Sani" ("İkinci Firon") olardı"[2474].

O həzrət (Şah Təhmasib) Səhənddən köçüb Çərəndabda[2475] məskən saldı. Həmin məqamda o xəbisin (Qazı Məhəmmədin) hamisi olan Heydər bəy Ənis də dustaq edildi və Qazı Məhəmmədlə birlikdə Ələmut qalasında məhbus oldu. Ondan sonra aləmin pənahı olan şah məiyyət və ordu ilə Təbriz dövlətxanasına yola düşdü. Seyidlər, qazılar, ağalar və əhali onu qarşılamağa tələsdilər və feyz bəxş edən qədəmləri önündə əyilməyin iftixarına və şərəfinə qovuşdular. [Şah] Xiyaban küçəsindən dəbdəbə ilə [şəhərə] daxil olub, səltənət taxtının məkanına və xilafət dairəsinin mərkəzinə dövlətlə, səadətlə, cah-calalla əyləşdi. Neçə gündən sonra Qəzvinə yola düşdü və həmin şəhərdə qışlaq etdilər.

---

[2474] Bu maddeyi-tarixin dürüst olmadığı nəzərə çarpır. Çünki "Fironi-sani" ifadəsinin əbcəd hesabı 967-yə bərabərdir və ondan iki il çıxdıqda 965-ci il edir. Halbuki 964-cü il olması lazımdır. Bu halda ikinci beytin ilk misrasını bu cür oxumaqla məsələni həll etmək olar: "Əgər həmin yaramaz üç il də qalsa idi" *(Nəvai, şərhlər, s.1400).*

[2475] Nuruosmaniyyə nüsxəsi: "Sərəndab".

### Mavəraünnəhrdə baş vermiş hadisələr haqqında söhbət. Özbəklərin bir-biriləri ilə vuruşması

Bu il Sultan Səid ibn Əbu-Səid xan ibn Kuçum xan, Abdulla xan ibn İsgəndər xan ibn Canibəy sultanla ittifaqda saydan-hesabdan ziyadə bir ordu ilə Səmərqəndi zəbt etməyə yollandı və o şəhərin yolunu tutdu. O əsnada sərvətinin bolluğu, qoşununun həşəməti və çoxluğu, məmləkətinin genişliyi ilə özbək sultanları arasında imtiyaza malik olan Büraq xanın oğlu Dərviş xan miqdarı qədərsiz və böyüklüyü ucsuz-bucaqsız olan çoxsaylı bir ordu ilə Daşkənddən çıxıb Sultan Səidlə və Abdulla xanla müharibəyə yollandı. Cəhm mövqeyində bir-birilərinə çatdılar və savaşdılar. Çalış-vuruşdan sonra Dərviş xan məğlub olub Daşkənd tərəfə qaçdı. Sultan Səid Səmərqəndi ələ keçirdi və Abdulla xan çoxlu ordu ilə Buxaraya yönəldi. Həmin zaman Übeyd xanın nəvəsi Bürhan Səid o diyarın hakimi idi. O, bir cavanla eşqbazlıq edirdi. Bir gecə gizli şəkildə həmin cavanın evinə getdi və o namərd onu qətlə yetirib başını Abdulla xanın yanına göndərdi. Sabah vaxtı Buxara ordusu hazır olub, Abdulla xanla döyüşmək istəyində idi. Lakin Bürhan Səidin qətli məlum olduqda, onlar bütün şəhəri [Abdulla xana] təslim edib onun mülazimi oldular.

### Müxtəlif əhvalatlar

Bu il Şahverdi sultan Ziyadoğlu və Süleyman bəy Qarabağ ordusu ilə Gürcüstana yollandılar. Aləmi yandıran qoşunların qorxusundan Simaun[2476] uca dağlara pənah apardı. Qazilər tamam Qori, Surem və Baratеli vilayətini qarət etdilər, onların məkan və məskənlərini viran qoydular, bar gətirmiş ağaclarını və taxıllarını kökündən qopardılar, müzəffər və qalib şəkildə, qeyri-məhdud qənimətlərlə Gəncəyə qayıtdılar.

O zaman dinin pənahı olan şah Təbrizdə idi. Ruma elçi getmiş Təbət ağa Zülqədər aləmin pənahı olan dərgaha gəldi və xondgarın göndərdiyi saysız töhfə və hədiyyələri təqdim etdi.

### Ölümlər

Kamran mirzə ibn Babur padşah ibn Mirzə Ömərşeyx ibn Sultan Əbu-Səid ibn Sultan Məhəmməd ibn Mirzə Miranşah ibn Əmir Teymur qardaşının məğlubiyyətindən sonra neçə il Kabil və Qəzneyn diyarında səltənət sürdü. Axırda Hümayun padşahın əlində dustaq olub kor edildi və Məkkeyi-müəzzəmədə sakin oldu. O, sözügedən ilin zilhiccə [ayında] (25.09-23.10.1557) axirət aləminə yollandı.

Herat valisi Məhəmməd xan Şərəfəddinoğlu Təkəlü bu il dünyadan köçdü. Dinin pənahı olan şah onun əmirliyini oğlu Qazağa verdi.

Bu il Dost xan, Yunis xanla döyüşüb qalib gəldi və Xarəzm vilayətini ələ keçirdi. Yunis xan öz qardaşları Pəhləvanqulu sultan və Üveys xanla ittifaqda Qəzvinə gəldi. Şənbə günü, rəcəb [ayının] 11-də (10.05.1557) onlar astananı öpməyə nail oldular. “Xarəzmlilərin gəlişi”[2477] [əbcəd hesabı ilə] həmin hadisənin tarixidir.

## 965-Cİ İLDƏ (24.10.1557 – 13.09.1558) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Qazilərin Aba Türkmənlə müharibə etməsi

Bu il Aba Türkmən imansız adamlardan [ibarət] bir dəstə ilə Astarabad ətrafına gəldi və vilayətin qarət olunmasını əmr etdi. O yaramazın qoşunları çaxnaşma atəşini yandırdılar, xof və qorxu topunu İbrahim xanın[2478] mətin qalasının divar və bünövrəsinə tuşladılar. Dəhşətli ox yağışı onun (İbrahim xanın) səbir və dözüm qalxanını parça-parça etdi və o, acizliklə, pərişanlıqla öz əhvalını dinin pənahı olan şahın dərgahına ərz etdi. Ona görə də [şah tərəfindən] qəzavü-qədər kimi cərəyan edən fərman verildi ki, Şahqulu xəlifə Möhürdar və Bədir xan Ustaclu sürətli yürüşlə Astarabada gedib Abanı dəf etsinlər. Onlar hökmə uyğun olaraq, şaban ayının ikinci gecəsində (20.05.1558) çoxlu ordu ilə Qəzvindən çıxdılar. Yadigar Məhəmməd bəy

---

[2476] Kartli çarı Simon nəzərdə tutulur.
[2477] “Amədəni-Xarəzmiyyə” = 964 h.
[2478] Bakı nüsxəsi: “İbrahim xan Zülqədər” (233a).

Türkman, Həsən bəy Qıcoğlu[2479] və Qasım bəy[2480] kimi digər əmirlər onlara qoşuldular. Aba Türkmən onların hərəkətindən xəbər tutduqda evini-eşiyini atıb fərar etdi. Qazilər onun ulusunu qarət edib orada dayandılar. O əsnada Aba Türkmən bədbəxt cahillərin bir dəstəsi ilə göründü və döyüşə əl atdı. Bəhram [kimi] intiqamçı əsgərlər tam sürətlə gəldiklərindən onların atları yorulmuşdu.

Beyt

“Atların hamısı yorulmuşdu, cövlan edə bilmirdilər,
Şətrənc atları kimi hamısı cansız idilər”.

Ona görə də döyüş odlarının alovlanması ta gecə vaxtınadək davam etdi. Abaya məlum oldu ki, bir iş görə bilməyəcək, üzünü çevirib sürətlə oradan uzaqlaşdı. O, yolda bir qatır qatarını[2481] ələ keçirib öz düşərgəsinə yollandı. Ertəsi gün öz qoşununu o nahiyələrin adamları hesabına çoxaldaraq döyüşə gəldi. Qazilərin atları yorğunluqlarını aldığından, hamısı birdən süvar olub ona həmlə etdilər. O, əfi ilan görkəmli nizənin ucundan böyük bir zəhmətlə xilas olub fərar yolunu tutdu. Türkmənlər bu döyüşdən vahiməyə düşüb Xarəzm yoluna çıxdılar və Əli sultanın yanına gedib ondan yardım istədilər. Ali soylu əmirlər türkmənlərin üzərinə sürətli yürüş etdilər[2482]. O biyabanda cahanı işıqlandıran günəşin istisindən buğda sünbülün içində üzərliyin atəşdə yandığı kimi yanırdı və əqrəbin neştəri əqiq kimi parlayırdı.

Beyt

“Havası məzlumun ahı kimi isti,
O qədər istidir ki, daş yumşaq muma dönüb.
Tava kimi zəmin atəş saçır orada,
Balıq kimi olmuş ilan orada büryan.
Əgər dirhəmi ovcunda sıxarsa simic,
Aşağı tökülər civətək gümüş”.

Yürüş əsnasında ordu sərdarı Şahqulu xəlifə Möhürdarı qarın sancısı tutdu və şənbə gecəsi, ramazan [ayının] 18-də (04.07.1558)[2483] vəfat etdi. Əmirlər Bədir xanın sözünü qəbul etməyib hər biri özbaşına hərəkət etdi. Bir neçə gün ərzində aləmi yandıran ordu o biyabanda türkmənlərin ulusuna basqınlar edərək öz atlarını yorduqdan sonra xəbər gəldi ki, Din Məhəmməd xanın qardaşı Əli sultan dinin pənahı olan şahın ona verdiyi ənamları və ona göstərdiyi lütfkarlığı unudaraq, döyüşmək iddiası ilə böyük bir qoşunla Xarəzmdən bu tərəfə doğru Aba Türkmənin köməyinə gəlməkdədir. Bədir xan bu haldan xəbərdar olduqda həmlə etmək əzmi ilə onların üzərinə yollandı. Əli sultan acizliyinin çoxluğu ucbatından öz ordusunun kənarında xəndək qazdırmış, çuvalları qumla doldurub qoydurmuş, dəvələri orada yerə yatırtmış, tüfəngçilər oturtmuş və sanki istehkamlı bir qala düzəltmişdi. Əmirlər döyüşə başladılar. Çevik cavanlar və adlı-sanlı igidlər həmlə etdilər. döyüş qızışdı. Qazilər xəndəyin kənarına çatdıqda özbəklər onları ox və tüfəng atəşi ilə qarşıladılar.

Şeir

“Tüfəng buludundan ildırım çaxmağa başladı,
O ildırımdan alovlar yağmağa başladı.
Kaman gözəllərin qaşlarını xatırladırdı,
Hər guşədən fitnə baş qaldırdı.
Tikanın qönçəyə azar verdiyi kimi,
Nizənin ucu cana çoxlu əzab verirdi”.

O əsnada Aba Türkmən iki yüz nəfər dilavərlə qoşunun arxasına keçdi. Hərçənd əmirlər Bədir xana “onu dəf etməyə bir dəstə göndər” desələr də, lakin o, qəbul etmədi. Aba Türkmən arxadan gəlib atışa başladı.

Nəzm

“Kamandan ox çəkib atdılar,

---

[2479] Bakı nüsxəsi və Baroda nəşri: “Həsən bəy Bəyoğlu”. Qıclu və ya Qıcoğlu – ustaclu tayfasına daxil olan obalardan biridir *(F.Sümer. Safevî devletinin kuruluşu, s.167).*

[2480] Bakı nüsxəsi: “Qasım bəy Durqudoğlu” (233b); Baroda nəşri: “Qasıməli bəy”.

[2481] Məclis nüsxəsi: “dəvə qatarı”.

[2482] Bakı nüsxəsi: “Ali soylu əmirlər Ətrək tərəfə sürətli yürüş etdilər” (233b).

[2483] Göstərilən miladi tarix şənbə gününə deyil, bazar ertəsi (düşənbə) gününə təsadüf etmişdir.

Fəğan qalxdı zəmindən və zamandan.
Parıldayan qanlı oxdan,
Bədən Bədəxşanləlinin dağına döndü.
Çıxdı ox quşu kamandan,
Ov şahini bürüdü asimanı”.

Türkmənlərin[2484] zərbələrindən qulluqçular qaçıb süvarilərə tərəf çəkildilər və [ordunun] mərkəzi bir-birinə dəydi. O əsnada Rüstəm xan Əfşar[2485] çoxsaylı qazilərdən [ibarət] bir dəstə ilə xəndəkdən keçib özbək ordusunun içinə girdi. Əli sultan iztiraba düşüb fərar etmək istədi. Təsadüfən Rüstəm xana tüfəng [gülləsi] dəyib onu öldürdü. Özbəklər cəsarətləndilər və hamısı birdən tədbirsiz qazilərə tüfəng və ox atdılar. Əmirlər muci və çərxçi olmadan [irəli] getdikləri üçün məğlub olub özlərini Gürgan çayına saldılar və bir çoxları fanilik girdabında qərq oldular. Həyat səbəbi olan su onların həlak səbəbi oldu. Feyzi ilə fidanı yaşıllaşdıran şirin su onların ömür ağacını yıxdı. Rəvan sərvə və xəndan gülə bənzər təxminən min cavan xəzan küləyinin bir əsməyi ilə torpağa və qana qəltan oldu. Zərli yəhərlərə və rəngli çullara malik gəmi rəftarlı və nəhəng cüssəli atların çoxu öz sahiblərinin əlindən buraxılmış və onların üzəngisi süvarinin ayağından ayrılmışdı. Onlar çölə üz qoyub orada otlayırdılar. İbrahim xan və bəzi süvarilər öldürüldülər. Bədir xan və Yadigar Məhəmməd bəy Türkman əsir alındılar. Həsən bəy Qıcoğlu[2486] və Əhməd bəy Qaya oğlu[2487] bir dəstə qazi ilə birlikdə salamatlıqla aradan çıxaraq Damğana gəldilər. Əli sultan o məkandan Xarəzm tərəfə geri döndü.

**Adlı-sanlı əmirlərin və ali mənşəli şahzadənin əli ilə Qəndəhar qalasının fəth edilməsi haqqında söhbət**

Hümayun padşah dinin pənahı olan şahın dərgahına gəldiyi zaman qərar vermişdi ki, Hindistan vilayəti yenidən onun ixtiyarına keçərsə, Qəndəharı dinin pənahı olan şahın mülazimlərinə təslim edəcəkdir. Hümayun padşah bir müddət sonra o diyarı ələ keçirsə də, elə həmin vaxtda tərifəlayiq xüsusiyyətlərə malik o şah (Hümayun) qürur məkanından (dünyadan) sürur məkanına (axirətə) köçdü və oğlu Cəlaləddin Məhəmməd Əkbər onun varisi oldu. Ona görə də hökm edildi ki, Bəhram mirzənin oğlu Sultan Hüseyn mirzə və Şiraz valisi Əli sultan Tatıoğlu düşmənləri məhv edən dilavərlərdən [ibarət] bir dəstə ilə Qəndəhar qalasının fəthini qarşıya məqsəd qoysunlar. Onların hamısı itaəti vacib olan hökmə tabe olub o diyara doğru yola çıxdılar. Qəndəhar qalasının ətrafı ali mənşəli şahzadənin və adlı-sanlı əmirlərin dayanacaq yeri olduqda təcrübəli qazilər və qala fəth edən sərkərdələr müharibəyə başladılar. Cəlaləddin Əkbər tərəfindən qalanın kutvalı olan Şah Məhəmməd Qəlati şücaətə başlayıb, [qızılbaşları] dəf etməklə və [onların] qarşısını almaqla məşğul olaraq çoxlu səy göstərdi. Uzun müddət vəziyyət bu minvalla davam etdikdən sonra axırda o, aciz qalıb qaladan aşağı endi və qalanın açarlarını təslim edib Əkbərin dərgahına, Aqraya yollandı. Sultan Hüseyn mirzə o diyarda sakin oldu. Digər əmirlər öz ölkələrinə getdilər.

**Müxtəlif əhvalatlar**

Düşənbə gecəsi, cəmadiyüləvvəl [ayının] 23-də (13.03.1558)[2488] Qəzvinə sel gəldi. Əbhər darvazasını su apardı. Təxminən iki min ev xarab oldu.

Həmçinin bu il dinin pənahı olan şah köhnə dövlətxanadan yeni dövlətxanaya köçdü. Mövlana Möhtəşəm yeni dövlətxananın tamamlanması tarixi barədə bir misrada [əbcəd hesab ilə] iki tarix demişdir:

“Ədalətli şahın necə də gözəl, hündür qəsri var,
Onun astanası Keyvana bərabərdir.
Şah onun başına çıxdıqda ağıl deyir ki,
Kəlim (Musa peyğəmbər) Turda qərar tutub.
Onun tamamlanmasının ili haqqında düşündüm,

[2484] Baroda nəşri: “ox və kaman”.
[2485] Baroda nəşri: “Rüstəm bəy Əfşar”.
[2486] Bakı nüsxəsi: “Fəsihoğlu” (234b); Baroda nəşri: “Fəthoğlu”.
[2487] Məclis nüsxəsi: “Məhəmməd bəy Fəna oğlu”.
[2488] Götərilən miladi tarix bazar ertəsi (düşənbə) gününə deyil, cümə axşamı (pəncşənbə) gününə təsadüf etmişdir. Baroda nəşri: “22-də”; Məclis nüsxəsi: “şənbə günü, 23-də”; Bakı nüsxəsində tarix yoxdur.

Bir misradan iki tarix oldu hasil.
Şah tarixin ili haqda soruşanda mən dedim:
“Behişti-bərin” əstü “xeyrül-mənazil”
(“Ali behişt”dir və “mənzillərin ən xeyirlisi”dir)[2489].

**Aba Türkmənin qətli haqqında söhbət**

Aba Türkmən qazilərə qalib gəldikdən sonra Xoca Müzəffər Bitikçinin oğlu Xoca Məhəmmədin qızını özünə arvad etdi. Xoca Məhəmmədin mülazimləri onun yanına gedib ona nökər oldular. O əsnada onlar ittifaq edərək xatunla söz qoydular ki, onu (Abanı) qətlə yetirsinlər. Aba bu xəbərdən agah olub, Mühibbəlini[2490] və onun yoldaşlarını çağıraraq onlara dedi ki, “siz məni öldürmək üçün ittifaq etmişsiniz və tezliklə mənim qəzəbimə giriftar olacaqsınız”. Onlar can qorxusundan and-aman etdilər ki, “eşitdiyiniz bu xəbər doğru deyildir”. Daha sonra qorxa-qorxa və titrəyə-titrəyə onun hüzurundan çıxdılar və onun dediklərini arvadına çatdırdılar. O dişi aslan dedi ki, “gərək filan yerdə bir neçə at hazır edib çadıra gələsiniz və o natamamın işini bitirəsiniz”. Onların hamısı gecə Abanın çadırına getdilər. Gözətçilər yağışın qorxusundan keçələri başlarının və bədənlərinin üzərinə salıb yuxuya getmişdilər. Onlar (sui-qəsdçilər) bir-birilərinə dedilər ki, “hansı birimiz bu əclafı aradan götürməyə gedək?”. Mühibbəli cəsurluğunun və pəhləvanlığının çoxluğundan çadıra girdi. Abanın yatdığını gördü. Bir qılınc zərbəsi ilə onun başını bədənindən ayırdı və o başı götürüb, qadınla birlikdə çadırdan çıxaraq özünü atlara yetirdi. İldırım və külək kimi Astarabada yollandılar və o başı Qəzvində müzəffər şahın dərgahına gətirdilər.

**Ölümlər**

Bu il fəzilətin sığınacaq tapdığı cənab, nəqli və əqli elmləri, füruiddini və üsuliddini[2491] öz şəxsində cəmləşdirən Şeyx Zeynəddin Cəbəlamili şəhid oldu. O həzrətin şəhidliyinin səbəbi budur ki, əhli-sünnətdən olan bir dəstə adam xondgarın vəziri-əzəmi Rüstəm paşaya [belə] demişdilər: “Şeyx Zeynəddin ictihad iddiası edib. Şiə əhlinin üləmasından bir çoxları onun yanına gəlib imamiyyə kitablarını mütaliə edirlər. Onların məqsədi rafizilikdir və əgər diqqətlə baxsan, məhz küfrdür”. Rüstəm paşa o həzrəti çağırmaq üçün adam göndərdi. Həmin zaman o dövran fəqihlərinin ən fəzilətlisi (Şeyx Zeynəddin) Məkkədə idi. Onu tutub İstanbula gətirdilər. Sultan Süleymana məlumat vermədən onu şəhid etdilər.

Nəzm

“O, bir elm dağı idi, qalxdı cahandan,
Dağsız necə qərar tutar yerin binası?!
Torpağın bədəni xəstəliyə düçar oldu onun yoxluğundan,
Lakin onun müqəddəs məzarı verdi torpağa şəfa”.

Əsərləri sırasında bunlar vardır: “Şərhi-şəraye” (“Şəriətin şərhi”), “Şərhi-ləm’ə” (“Parlaq şərh”), “Şərhi-şafiyyə” (“Şəfa verən şərh”), Şeyxi-Şəhidin (Şeyx Şəmsəddin Məhəmmədin) “Qəvaid”i üslubunda [yazdığı] “Qəvaid” (“Qaydalar”), “Risaleyi-əsrarül-saləvat” (“Namazların sirləri haqqında risalə”), “Risaleyi-mənaseki-Həcc” (“Həcc ayinləri risaləsi”), qeybə hörmət haqqında bir risalə.

**966-CI İLDƏ (14.10.1558 – 02.10.1559) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT**

Bu il Rum padşahı Sultan Süleyman, Sultan Bayəzidi Kütahya[2492] hakimliyindən çıxarıb o diyarın idarəsini Konyada olan böyük oğlu Sultan Səlimə həvalə etdi. Elə ki Sultan Bayəzid qardaşı barəsində adlısanlı atasının səltənət, iqtidar, hüsn-rəğbət və şəfqət xəbərlərini eşitdi, qardaşlıq sikkəsini kin və həsəd ləkə-

[2489] Əbcəd hesabı ilə h. 965-ci ilə bərabərdir.
[2490] Mühibbəli – Abanın həyat yoldaşının mülazimlərindən idi.
[2491] Üsuliddin və füruiddin – şiə əqidəsinə görə, müsəlmana vacib olan ehkamları əhatə edirlər. Belə ki, üsuliddin (“dinin əsasları, kökləri”) islam dininin etiqadla, inancla əlaqədar məsələlərini əhatə edir və 5 maddədən ibarətdir. Füruiddin (“dinin budaqları”) isə islam dininin zəruri əməlləri ilə bağlı məsələləri ehtiva edir və 10 maddədən ibarətdir. Bir sözlə, üsuliddin müsəlmana nəyə inanmaq lazım olduğunu, füruiddin isə hansı əməlləri yerinə yetirməyin vacib olduğunu öyrədir.
[2492] Kütahya – Türkiyənin qərb hissəsində, Eskişehirdən cənub-qərbdə şəhər və vilayət mərkəzi.

ləri ilə korladı və sədaqətin səfalı tərzini məkr və hiylə zir-zibili ilə kirləndirdi. Onun beynində pozuq xəyallar və batil təsəvvürlər yer tutdu və qardaşına xilaf çıxmağın şüarını hər tərəfdə zahir etdi. Həm sadə camaata, həm də say-seçmə adamlara çoxlu mallar paylayıb qısa zamanda elə bir böyük qoşun tərtib etdi ki, hamısı şir kimi yırtıcı və qılınc kimi kəsici idilər. Ordu topladıqdan sonra Sultan Səlimi dəf etmək üçün Konya tərəfə hərəkətə gəldi. Lakin o bilmirdi ki, iqbalı idbara dəyişən və səadəti nəhsliklə əvəzləyən adama malın bolluğu və qoşunun çoxluğu fayda verməz. Mərvan Həmmarın[2493] sözüdür: "Müddət başa çatıbsa, say çoxluğu fayda verməz".

Bu xəbər o diyarda yayıldıqda Sultan Səlim bu əhvalatı eşitməkdən mütəəssir oldu. O, Sultan Süleymanın yanına yaxşı nitq qabiliyyətinə malik adamlar göndərdi və bəhs olunan hadisəni ərz etdi. Bu ədəbsizliyi eşidən ali nəsəbli padşahı tər basdı. Hökm etdi ki, Anadolu əmirülümərası Əhməd paşa, Qaraman hakimi Fərhad paşa və Əli paşa Zülqədər dağ şəkilli, fələk əlamətli, ifrit görkəmli, Əhrimən surətli bir qoşunla sürətli yürüş edərək o diyara getsinlər və Sultan Bayəzidi tutub yoxluq zaviyəsində sakin etsinlər (öldürsünlər).

Onlar Konya ətrafına çatdıqda, Sultan Səlim qaladan çıxıb onlara qoşuldu. Şəhərin kənarında, Sultan Bayəzidin qarşısında ordu səfi tərtib etdilər[2494]. O zaman Sultan Bayəzid tərəfdən bir dəstə igidlik şüarlı rumilər Sultan Səlimin ordusunun üstünə hücum etdilər və dövr edən günbəzə (asimana) döyüş sədası saldılar. Onlar da müdafiə mövqeyi tutub vuruşmağa başladılar. Qılıncların şimşəklərindən və oxların ildırımlarından döyüş meydanının ortasında qan arxı axmağa başladı.

Beyt

"Qandan yeddi dərya bir-birinə qarışdı,
Zəmin digər tərəfdən nəm verdi".

Cahanı işıqlandıran günəş parlaq oxun qorxusundan bulud cövşəni geymiş və qaniçən Mərrix döyüş meydanı dilavərlərinin qanını görüb başına qalxan çəkmişdi. Həmin gün səhərdən axşama kimi döyüş və vuruş atəşi alovlandı. Amma tale qələmi qəzavü-qədər lövhəsi üzərində Sultan Bayəzidin istəyinə zidd yazı yazdı. Hər iki tərəfdən səkkiz min süvari və piyada qətlə yetirildi. Ondan sonra xəncər vuran günəş məğrib xanəsinə doğru hərəkət bayrağını yüksəltdi.

Nəzm

"Qaranlıq gecə oldu, çünki xurşid çöhrəli şah (günəş),
Aşağı endi asimanın atından.
Görünmədi gecə vaxtı döyüş silahı,
Çünki yaxşını və pisi fərq etmək mümkün olmur.
Hər iki tərəfin ordusu atdan endi,
Qızmış şir kimi başdan başa kinli idilər.
Elə ki dağdan baş qaldırdı yuxarıya günəş,
Fitnə axtaranların başı yuxudan oyandı.
Tüfəng mavi paltarlı səmaya səs saldı,
Nizə günəşin gözünə mil çəkdi".

Səhər çağı hər iki qoşunun kişiləri və hər iki ölkənin igidləri gürz və xəncərə əl atdılar. O gün Sultan Bayəzid qan saçan qılıncla və əfi ilan misallı nizə ilə elə döyüşdü ki, Rüstəm və İsfəndiyar dastanı yaddan çıxdı. O, Sultan Səlimin meymənə və meysərəsini məğlub etdi. Belə ki, [Sultan Səlimin ordusundan] qaçanlar İstanbuladək heç yerdə qərar tutmadılar. Amma Sultan Səlim mərkəz ("qəlb") qoşunu ilə Sultan Bayəzidin mərkəzinə ("qol"una) həmlə etdi və onların cəmiyyət xanəsinin şüşəsinə təfriqə daşı vurdu. Fəlakət küləyi Sultan Bayəzidin pərçiminə əsdi. O, başını tutub Amasya tərəfə qaçdı. Məqsədinə çatması[2495] üçün öz mötəbər mülazimlərindən üç nəfəri öldürüb onların başlarını ərizə ilə birlikdə Sultan Süleymanın yanına göndərdi. [Ərizəsinin] məzmunu belə idi: "Bu camaat məni müxalifliyə təhrik etdi. Cəhalətimin və qürurumun bais olduğu xoşagəlməz düşmənçilikdən peşman olmuşam və təəssüf barmağımı ağzıma qoymuşam. Əgər o

[2493] Mərvan Həmmar – sonuncu Əməvi hökmdarı II Mərvan.

[2494] Osmanlı şahzadələri Səlimlə Bayəzid arasında döyüş 29-30 may 1559-cu ildə Konya şəhəri yaxınlığında baş vermişdir. Daha ətraflı bax: *J.V.Hammer. Osmanlı tarıhı, II c., s.43-44.*

[2495] Tehran çapında (s.1412) səhvən "məqsədinə çatdığı üçün" yazılmışdır.

həzrət (Sultan Süleyman) bu fəqirin əhvalına öz qayğıkeşliyini şamil edərsə və bu günahlarımın naxışını əfv suyu ilə yuyarsa, qədəm əvəzinə başımı yerə qoyub sürünə-sürünə dərgaha gələrəm". Sultan Süleyman onun ərizəsini qəbul etməyib, acıqla və kinlə yenidən onu dəf etmək üçün böyük bir ordu göndərdi. Sultan Bayəzid həmin ordunun gəlişindən agah olduqda, fərar yolunu tutub köçhaköçlə Ərzuruma gəldi. O diyarın hakimi Ayaz paşa öz məxsusi adamlarından birini çoxlu töhfələrlə həmin ali mənşəli padşahzadəni qarşılamağa göndərdi. Sultan Bayəzid o həndəvərdə dayandı. Neçə gündən sonra İsgəndər paşa xondgarın əmri əsasında yaxşı silahlanmış qırx min süvari ilə, çoxlu adamla sürətli yürüş edərək oraya çatdı. Sultan Bayəzid zərurət üzündən yüklərini və mallarını o nahiyədə qoyub, can qorxusu səbəbindən etimadlı adamlarından on min nəfərlə birlikdə fərar yolunu tutdu. Quduz Fərhad, Axsaq Seyfəddin və b. şücaətlilər döyüşə-döyüşə onu savaş meydanından sağ-salamat çıxardılar. İsgəndər paşa Kağızmana qədər onları təqib etdi. Sultan Bayəzid böyük təşvişlə yolları qət etdikdən sonra İrəvana çatdı.

O vilayətin hakimi Şahqulu sultan Ustaclu onun gəlişindən agah oldu və dinin pənahı olan şahın dərgahına bir qasid [ilə ərizə] göndərdi. Bu ərizəni gətirən adam Qəzvinə gəldi və [ərizənin] məzmunu dinin pənahı olan şahın ərzinə çatdırıldı. O həzrət Həsən bəy Yüzbaşını çoxlu töhfələrlə ali mənşəli şahzadənin yanına göndərdi. Sultan Bayəzid dinin pənahı olan şahın dərgahına yollanıb bayraq və sancağını İraq səmtinə yüksəltdi. Elə ki Təbriz şəhərinə çatdı, o diyarın hakimi Əmirqeyb bəy Ustaclu əzəmətli seyidlər, hörmətli nəqiblər, əyan-əşrəflər, böyüklər, bazar adamları və əsnaflarla birlikdə onu qarşılamağa çıxdılar. Qələbəlik və izdiham tamam çölü və dağı bürüdü. Dar yollarda o qədər camaat toplanmışdı ki, heç bir bayramda və Novruzda o qədər adam müşahidə olunmamışdı. Qeysəriyyəni və bazarları bəzəmişdilər. Müğənnilər və mütrüblər lətafətli avazlarla və ürək oxşayan nəğmələrlə ahəngdar nəqəratları ta fələyin zirvəsinə qədər çatdırmışdılar. Sultan Bayəzid Qeysəriyyəyə gəldi. Heç tərəfə nəzər salmayıb, yalnız atının iki qulağı arasından baxdı. Ondan sonra Çərəndabda dayandılar. Bu neçə gündən sonra mətləbə doğru yola düşdülər.

### Müxtəlif əhvalatlar

Bu il Rum padşahı Sultan Süleyman Qanlı çəməndə əsir düşmüş və dinin pənahı olan şah tərəfindən azad edilmiş Sinan bəyi yaxşı hədiyyələr və rəğbətli töhfələrlə [Səfəvi sarayına] göndərdi, məhəbbətamiz və dostyana sözlərini çatdırdı.

### Ölümlər

Mövlana Əhməd Bavərdinin oğlu Mövlana Əbülhəsən özündə elmləri və çeşidli hikmətləri toplamış, növbənöv fəzilət və kamillikləri cəmləmişdi. Ali fitrəti səbəbindən misilsiz dərəcədə xoş təbiətli idi. Bilik və ibarələr gözəlliyi baxımından bənzərsiz idi. Əyyamın qulağı və boynu onun fəzilətinin cavahirindən zinət tapmışdı.

Beyt

"Onun ali elmini dərk etməyə müdriklərin gözü acizdir,
Onun fəzilət ayəsinin dərinliyindən natiqlərin canı naçardır".

Fəhminin gücü və nitqinin gözəlliyi o dərəcədə idi ki, bilikli alimlərin heç birinin onunla mübahisə etməyə macalı yox idi.

Nəzm

"Gah suallarının qarşısında müdriklər cavab tapa bilmirdilər,
Gah da ki, məntiqinin müşküllərini natiqlər çözə bilmirdilər".

Bu il, yekşənbə günü, ramazan [ayının] 26-da (02.07.1559) o dövran alimlərinin alimi qürur sarayından (dünyadan) sürur aləminə (axirətə) getdi. Əsərləri sırasında bunlar vardır: "İsbati-vacib" ("Vacib olanın isbatı"), hikmət haqqında "Rövzətül-cinan" ("Cənnət bağı"), "Risaleyi-məntiq" ("Məntiq risaləsi"), miras [hüququ] haqqında məlumat verən "Şərhi-fəraiz" ("Mirasın şərhi"), kəlam haqqında "Mətni-şəvariq" ("Parıltıların mətni").

Bu sətirlərin müəllifi olan dəyərsiz zərrə (Həsən bəy Rumlu) o böyük şəxsiyyətin yanında "Şərhi-təcrid" ("Təcrid şərhi") [əsərini] mütaliə etmişdir.

## 967-Cİ İLDƏ (03.10.1559 – 21.09.1560) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Elə ki Sultan Bayəzid Qəzvin ətrafına çatdı, dinin pənahı olan şah həzrətlərinin vəkili mənsəbinə malik olan Məsum bəy Səfəvi böyük əmirlərlə, o cümlədən Seyid Kəmunə, Sevindik bəy Qorçubaşı və Əliqulu xəlifə Möhürdarla birlikdə onu qarşılamağa tələsdi. Sultan Bayəzid hamısı ox, qılınc və tüfəng kimi döyüş əsləhələrinə və ərəb atlarına malik dəmir sədd kimi qoşunlarla Qəzvin meydanına gəldi. Dinin pənahı olan şah öz ordusunu yerli yerində qoyub, qorçubaşı, ox və kaman qorçusu Hüseyn bəy və digər iki müqərrəblə birlikdə irəli gedərək onların çoxluğundan əsla çəkinmədi. Sultan Bayəzid xoş rəftarlı atından aşağı endi və dinin pənahı olan şahla əl-ələ görüşdü. Onlar dərhal birlikdə dərgaha daxil oldular və bir-birinin yanında əyləşdilər.

Bir neçə gündən sonra dinin pənahı olan şah həmin meydanda böyük ziyafət təşkil edib Sultan Bayəzidi [oraya] dəvət etdi və ona hörmət, ehtiram göstərib onun əmirlərinə və müqərrəblərinə münasib məkanlarda yer verdi. Yeyib-içdikdən sonra ona təxminən on min tümən məbləğində nağd pullar və mallar[2496] hədiyyə edildi. Dinin pənahı olan şah onun günahını əfv etdirməyə təşəbbüs göstərərək Ağcasaqqal Əli ağa Qacarı xondgarın yanından gəlmiş Sinan bəylə birlikdə Sultan Süleymanın hüzuruna göndərdi. Ərəştə ağa Zülqədəri isə Duraq bəyin müşayiəti ilə Sultan Səlimin hüzuruna yolladı. [Şahın] ismarışının məğzi bu idi ki, “bundan sonra sizinlə Sultan Bayəzid arasında uzlaşmanın baş verməsini, sədaqətin təməlinin möhkəmlənməsini və hər iki tərəfin könül aynasının düşmənçilik rəngindən arınmasını istəyirəm”.

Bu əhvalat əsnasında Sultan Bayəzid qaragün bəxtinin ucbatından, ona pis şeylər öyrədən yaramaz adamların fəsadı ilə doğru yoldan sapıb, dostluq əli ilə düşmənçilik bağını suvarmaq və səmimiyyət şərbətinə nifaq zəhəri qatmaq fikrinə düşdü. O nakəsin yaxın adamlarından Qara Uğurlu və Mahmud Çərkəz o vəfasızın xəyanətini dinin pənahı olan şaha ərz etdilər. Sultan Bayəzid bundan xəbər tutub gecə ikən onları qətlə yetirdi. O səbəbdən zaman-zaman təhlükə şöləsi alışdı və ziddiyyət atəşi məhəbbət və ülfət səbəblərini yandırdı. Nəhayət, bir gün dinin pənahı olan şah, Sultan Bayəzidlə bağda gəzərkən, Sultan Bayəzidin xidmətində olan Ərəb Məhəmməd Trabzoni özünü dinin pənahı olan şaha çatdırıb astadan dedi ki, “ərz edilməsi vacib olan iki kəlmə sözüm var”. Ali hökmdar onunla divanxanada görüşəcəyini vəd etdi. Sultan Bayəzid bundan xəbərdar olub o fəqiri qətlə yetirdi. Elə ki dinin pənahı olan şah onun qətlindən xəbər tutdu, zərurət üzündən onun (Bayəzidin) dəf edilməsi fikrinə düşdü.

O həzrətin (Şah Təhmasibin) kədərə qapıldığı hamıya zahir olduqda, cümə günü, şam namazında şəhərin və bazarın avam adamları onun (Bayəzidin) evinə hücum çəkib, tənə və lənət edərək onun qapı-bacasına daş atdılar. Bu hadisə əşrəfin istəyinə müvafiq deyildi və ixtiyarsız olaraq baş vermişdi. Daha o camaata (Bayəzidə və ətrafına) etimad qalmamışdı. Ona görə də cümə ertəsində bəzi əmirlər onun mənzilinə gedib, qəti hökm əsasında onu oğulları ilə birlikdə dövlətxanaya gətirdilər. Həmin günün ikindi vaxtında onu azadlıqdan məhrum etdilər. Onun Lələ paşa, Fərrux bəy, Sinan Miraxur, İsa Çaşnigir[2497], Xoca Ənbər və başqaları kimi fəsadçı mülazimlərini qətlə yetirdilər. Onun böyük oğlu Orxanı Həsən bəy Yüzbaşıya, Sultan Mahmudu Məsum bəyə, Sultan Məhəmmədi qorçubaşıya, Sultan Abdullanı Mir Seyid Şərifə tapşırdılar. Özünü isə dövlətxananın əndərununda hifz etdilər və ona [nəzarət üçün] qorçular təyin olundu.

### Budaq sultan Qacarın və qazilərin özbəklərlə döyüşməsi və onların (özbəklərin) məğlub olması haqqında söhbət

Bu il Əli sultanın fərmanı əsasında Sarı Qurğan[2498] bir dəstə özbəklə Nişapura gəldi ki, o diyarı qarət etsin. Budaq sultan Qacar və Süleyman bəy Məlkənoğlu Zülqədər cövşən geyən qazilərdən [ibarət] bir dəstə ilə o bədbəxt qövmü dəf etmək üçün şəhərdən çıxdılar. Döyüşkən dilavərlər və tünd xasiyyətli əmirlər o dəstəyə çatdıqda döyüşə başladılar. Hər iki tərəfin səylərindən və hərb atəşinin alovlanmasından sonra qızılbaş

---

[2496] Məclis nüsxəsi: “on min tümən nağd pullar və üç min tümən mallar”.

[2497] Çaşnigir (farsca “dada baxan”) – hökmdarların yeməklərinin qabaqcadan dadına baxan və bununla da yeməyin zərərsiz və dadlı olduğunu müəyyənləşdirən məmur. Çaşnigirlərə çaşnigirbaşı adlanan məmur rəhbərlik edirdi.

[2498] Məclis və Bakı nüsxələri: “Qurxan”.

ordusu pis davranışlı özbəklərə qalib gəldi. Sarı Qurğan bir çox özbəklərlə birlikdə qətlə yetirildi. Onlardan bəziləri can qorxusundan özlərini kəhrizlərə saldılar. Qazilər onları çıxarıb gedər-gəlməzə göndərdilər.

### Müxtəlif əhvalatlar

Bu il Cəlaləddin Əkbər padşah, Bayram xana qəzəblənib Ətəkə[2499] ilə ittifaqda Dehliyə yollandı. Ona görə də bütün qoşun, hətta Bayram xanın xas mülazimlərindən bəziləri rüxsətlə və bəziləri rüxsətsiz şəkildə xandan ayrılaraq padşahın xidmətinə gəldilər. Bayram xan Nagur tərəfə gedib bir müddət sonra yolunu azmış adamların təhriki ilə Pəncaba[2500] yollandı. Elə ki bu xəbər alicənab hökmdara çatdı, Ətəkə xanı çoxlu ordu ilə birlikdə Bayram xanı dəf etməyə göndərdi və özü də nəfis vücudu ilə həmin ordunun arxasınca yola düşdü. Ətəkə xan Bayram xana qalib gəldi. Bayram Kiş dağına sığındı. Padşah məiyyət və ordu ilə oranın ətrafına gəlib cah-calalla dayandı. Bayram xan onun hüzuruna gəldi. Bir neçə gündən sonra padşah ona Məkkeyi-müəzzəməyə [getməyə] rüxsət verərək özü Aqraya tərəf geri qayıtdı.

Bu il, ramazan [ayının] (26.05-24.06.1560) əvvəllərində dinin pənahı olan şahın şərəfli və müqəddəs zatında xəstəlik peyda olub iki ay sonra sağaldı və möminlərə təzə həyat və əndazəsiz sevinc üz verdi, qəm və təhlükə rəngi ürəklərin aynasının üzərindən təmizləndi, xəstəlik əziyyəti din və dövlət düşmənlərinə keçdi. Hökmdarın vücudu elə bir bəladan şəfa tapdı ki, beləsi düşmənlərə nəsib olsun.

Nəzm

“Mülkün ayı məhaqdan çıxdı,
Cahanın güzəranı xoşbəxt oldu.
Şənlik İsaya yoldaş oldu,
Qəm-qüssə Qaruna[2501] yoldaş oldu.
Yusif quyudan xilas oldu,
Yunis böyük balığın qarnından çıxdı[2502].
Səadət bəxtinin ulduzu doğdu,
Ruzigarın taleyi bəxtiyar oldu”.

Həmçinin bu il Gürcüstan hakimi Ləvənd bəyin oğlu İsa xan islamı [qəbul etmək] səadətinə nail olub o həzrətin (Şah Təhmasibin) xeyirxah nəzərinin qayğıkeşliyi ilə əhatə edildi.

## 968-Cİ İLDƏ (22.09.1560 – 10.09.1561) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Şahverdi sultan Ziyadoğlunun Gürcüstan hakimləri ilə döyüşməsi və Gürginin öldürülməsi

Bu il Gürcüstan hakimi Simaun, Ləvənd bəyin oğlu Gürginlə ittifaqda Tiflisə yürüş iddiası ilə Kuç qalası ətrafına gəldilər və Gürcüstan vilayətinin [müxtəlif] tərəflərinə adam göndərib o diyarın əsgərlərini çağırdılar. Qısa zamanda o qədər hazırlıqlı adamlar və növrəstə cavanlar oraya toplaşdılar ki, qoca fələyin gözü sabiq zamanlarda və keçmiş qərinələrdə o diyarda [bu qədər qoşunun toplaşmasını] müşahidə etməmişdi.

Elə ki onlar [haqqında] xəbər Şahverdi sultanın qulağına çatdı, Gəncədən çıxıb Qarabağ qoşunu ilə [birlikdə] imansız gürcüləri qırıb-biçməyə yollandı. O, bir dəstəni mənqəlay təyin etdi. Onlar gürcülərin qazdıqları xəndəyi doldurub [Şahverdi] sultana xəbər göndərdilər. O da xəndəkdən keçib tam sürətlə onların (gürcülərin) üzərinə hərəkət etdi və ... mövqeyində[2503] onlara çatdı. Qazilər Həzrəti-vacibül-vücuda (Allaha) dua etdilər: “Ey Rəbbimiz, bizə bol-bol səbir və dizimizə (ayaqlarımıza) qüvvət ver! Bizə kafir qövm üzərin-

[2499] Görünür, burada Şəmsəddin Məhəmməd xanın oğlu olan böyük xan Mirzə Kükəltaş Ətəkə nəzərdə tutulur *(Nəvai, şərhlər, s.1418)*.
[2500] Pəncab – indiki Pakistanda bir vilayət.
[2501] Qarun – Musa peyğəmbərin zamanında yaşamış, maddi zənginliyi ilə tanınmış və Allahın əmrlərinə qarşı çıxdığı üçün cəzalandırılmış şəxs *(Ö.F.Harman, H.İ.Şener. Kârûn // TDVİA, cilt: 24, yıl: 2001, s.519-520)*.
[2502] Bu beytdə Yusif və Yunis peyğəmbərlər haqqındakı dini hekayələrə işarə edilmişdir.
[2503] “Əhsənüt-təvarix”in nüsxələrində bu yerin adı boş buraxılmışdır. Gürcü mənbələrinə görə, həmin vuruşma 1561-ci ildə Tsixedidi adlı yerdə baş vermişdir *(«Парижская хроника», с.30)*.

də qələbə qazandır!”[2504]. Çərxilər onların (gürcülərin üzərinə) at çapdılar. Simaun və Gürgin tərəfdən də kin meydanının aznavurları və şücaətli sərkərdələr oxa, kamana, qılınca və nizəyə əl atdılar.

Beyt

“Hər guşədən zamanın Rüstəm ürəkliləri,
Çəkdilər, atdılar oxu kamandan”.

Axırda müzəffər qazilər və igidlik dəryasının nəhəngləri o səadətsiz gavurların məcmusunu yəhər üstündən torpaq üzərinə saldılar. Bu əsnada Şahverdi sultan mərkəz (“qəlb”) qoşunu ilə onların üzərinə at çapdı və gavurlar döyüş meydanından fərar etdilər.

Şeir

“Lakin axırda döyüşün ali çarxı,
Düşmən qoşunundan toz çıxardı.
Yıxıldılar çevik yüyənli gavurlar,
Birisi oxla və digəri nizə ilə.
Birinin ürəyi oxdan yaralanıb qana bələnmiş,
Tikanın ucundan qönçə yaralandığı kimi”.

Gürgin nərə çəkən şirdən qaçan vəhşi tülkü kimi fərar vadisinə tələsdi. Qacar qoşununun aslanları o it sifətli yaramazları rəzil (hərfən: “quyruğu kəsik”) etdilər, onları bir-bir “Şeytanın başına bənzəyən meyvələr”[2505] kimi zillət torpağı üzərinə sərdilər. Gürgini min nəfər kafirlə birlikdə qətlə yetirdilər. Gürcüstanın mötəbər əmirlərindən olan Zaza bəyi bir dəstə aznavurla əsir edib, dinin pənahı olan şahın dərgahına göndərdilər. Simaun az sayda gürcü ilə döyüş meydanından xilas olub Qori tərəfə getdi. Şahverdi sultan Ziyadoğlu çoxlu qənimətlərlə Gəncəyə qayıtdı. Elə ki Ləvənd bu xəbəri eşitdi, sinə təndirindən çıxan atəş şöləsinin təsirini fələyə çatdırdı və onun göz fəvvarəsindən torpağa qanlı su töküldü. Gürcülərin hamısı matəm libasları geydilər.

## Müxtəlif əhvalatlar

Bu il içində qışlaq və yaylaq Qəzvində oldu.

Bu il içində Sultan Süleymanın yaxın və etimadlı adamları cümləsindən olan Mərəş hakimi Əli paşa və Həsən ağa Qapıçıbaşı[2506] başda olmaqla yeddi yüz altı nəfərlik elçilik heyəti seşənbə günü, 22 rəcəbdə (08.04.1561) Qəzvinə gəldi. Onlar daş-qaşla bəzədilmiş əşyalardan ibarət hədiyyələr, məsələn, qılınc kəməri, xəncər kəməri, nəfis Firəng qumaşları və bir çox digər nəfis şeylər gətirmişdilər. Kübar əmirlər və adlı-sanlı müqərrəblər onları görməyə getdilər və onların gəlişini salamladılar. Neçə gündən sonra dinin pənahı olan şah fələyin qübbəsinə həsəd verən səadətli bargahında əyləşdi və cahanın pənahı olan dərgah günəş üzlü, Müştəri əlamətli padşahzadələrin çöhrəsinin nuru ilə bəzəndi. Həzrətin (Şah Təhmasibin) əmirləri və dövlət ərkanı öz yerlərində qərar tutdular.

Nəzm

“Əyləşdilər şahzadələr şahın ətrafında,
Necə ki, Yeddiqardaş ulduzları ayın ətrafına toplaşır.
Dayandılar aciz bəndələr kimi,
Əmir və vəzir solda və sağda.
Döyüş təcrübəli ad-san sahibləri,
Niyaz ilə başlarını önə əydilər.
Yerli yerində xoş kəlam deyən nədimlər,
Bağladılar dodaqlarını ehtiram üzündən.
Daş-qaşlı kəmərə malik pəhləvanlar sərbəsər,
[Şahın] hüzurunda hamısı əllərini kəmərə qoydu”.

---

[2504] *Qurani-Kərim, “Bəqərə” surəsi, 250-ci ayə.*
[2505] *Qurani-Kərim, “Saffat” surəsi, 65-ci ayə.*
[2506] Qapıçıbaşı – saray qapıçılarının başçısı.

Əli paşa və Xosrov ağanı tam izzətlə içəri gətirdilər. Dinin pənahı olan şah elçilərlə iqtidar sahibi padşahlar və ali mənşəli hökmdarlar üsulu ilə görüşüb məhəbbətli kəlmələrin və dostyana ifadələrin sığalı ilə onların könül aynasından kədər pasını təmizlədi. Yemək məclisinin qurtarmasından sonra [şah] izzət və ehtiramla öz otağına çıxıb getdi. Neçə aydan sonra ali məqamlı hökmdar [elçilərə] külək rəftarlı və zərnigar yəhərli atlar, dəyərli xələtlər və bol ənamlar hədiyyə etdi, əmirlər silkinə daxil olan Cəfər bəy Ustaclunu onlarla birlikdə elçi sifəti ilə Ruma göndərdi.

Bu il Cəlaləddin Əkbər padşah, Ədhəm xanı və Pir Məhəmməd xan Şirvanini altı min süvari ilə Məndar vilayətini fəth etməyə göndərdi. O diyarın valisi Baz Bahadır çoxlu qoşunla onu qarşılamağa gələrək döyüşdən və vuruşdan sonra qaçış yolunu tutdu. Cəlaləddin Əkbər padşah neçə gün o həndəvərdə qaldı. O diyarın zəbtindən sonra Aqraya geri qayıtdı.

**Ölümlər**

Mirzə Şərəfin ölümü. Mirzə Şərəf dinin pənahı olan şahın vəkili Qazı Cahan Qəzvininin oğlu idi. Müxtəlif elmlərə yiyələnmişdi, növbənöv fəzilətlərə və kamilliklərə sahib olmuşdu. Həqiqətən də, şərəfli atası nə cür fəzilət və istedada malik idisə, oğlunda həmin xüsusiyyətlər və fəzilətlər daha artıq idi. Bundan başqa, digər kamillikləri də vardı. Bəlkə də, onun inşası atası ilə müqayisədə daha yaxşı və fitrəti daha ali idi. Şeirdə səliqəsi çox müvafiq idi. Şairlikdə və natiqlikdə üfüqlərin yeganəsi idi.

Onun şərəfli atası vəzirlik mənsəbində çalışan zaman o, həmin həzrətin naibliyində camaatın işlərinin intizama salınması ilə məşğul olurdu və səlahiyyət sahibi idi. Amma dinin pənahı olan şahın hüzuruna az-az gedib-gəlirdi. Bu səbəbdən atasının könlü həmişə ondan incik idi. Uzun sözün qısası, Mirzə Şərəf Cahanın bərəkətlərlə feyzlənmiş zatının malik olduğu yeganə nöqsan, zatının xəbisliyi cahan sakinlərinə aşkar olan Mövlana Fazil[2507] Xalxali ilə ünsiyyət və dostluq etməsi idi.

Rum padşahı Sultan Süleymanın vəziri-əzəmi Rüstəm paşa onun (Süleymanın) qızını alıb, kürəkəni olmuşdu. O, 11 şəvvalda (25.06.1561) təbii əcəllə vəfat etdi və beytül-mala müqayisəyəgəlməz [qədər] mal qoyub getdi. Rüstəm paşanın yerinə Əli paşa vəziri-əzəm oldu.

Bayram xan – Seyfəli bəy Baharlunun oğludur. O, Cahanşah padşah zamanında Dinəvər, Həmədan və Kürdüstan hakimi olmuş Əlişəkər bəyin nəslindəndir. Qələmrovi-Əlişəkər (Əlişəkər ölkəsi) [ifadəsi] onun [adından] yaranmışdır. Bayram xanın ulu babası Pirəli bəy, Əbu-Yusif mirzənin qətlindən sonra Xorasana getdi, oradan Bədəxşana yollandı və axırda Sultan Hüseyn mirzənin mülazimlərinin əli ilə öldürüldü. Onun oğlu Barik Qunduzda Əmir Xosrovşahın mülazimliyində idi. Babur padşah Əmir Xosrovşahı məğlub etdikdə Barik və oğlu Seyfəli bəy o həzrətin xidmətinə keçdilər. Bayram xanın atası vəfat etdikdə o, uşaqlıqda Bəlxə düşüb, daha sonra Hümayun padşahın dərgahına gələrək o həzrətin qayğıkeşliyi ilə əhatə olundu. Hümayun padşahın ölümündən sonra o, səltənətin bütün işlərini özü idarə edirdi. Padşahdan Həccə getmək [haqqında] rüxsət aldıqdan sonra Gücəratın[2508] Nəhravələ şəhərinə çatdıqda bir şəxs onu xəncərlə vurdu. Bu səbəbdən Bayram xan varlıq libasını yoxluq küləyinə verdi və onun [ölüm] hadisəsinin tarixi barədə [belə] demişlər:

Şeir

Bayram Kəbəni təvaf üçün ehram bağladı,
Yolda şəhid oldu, işi sona çatdı.
Bu hadisənin tarixi haqqında bir səs,
Dedi ki, "şəhid oldu Məhəmməd Bayram"[2509].

**969-CU İLDƏ (11.09.1561 – 30.08.1562) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT**

Daha öncə Ruma elçi gedən, Əmirqeyb bəy Ustaclunun qardaşı olan və o vaxt yasavulbaşı vəzifəsini daşıyan Vəli bəy xondgarın elçiləri ilə – Van hakimi Xosrov paşa, Əli ağa Qapıçıbaşı və iki yüz nəfər digər şəxslə – birlikdə pəncşənbə günü, zilqədə [ayının] 14-də (16.07.1562) Qəzvinə gəldi. Yekşənbə günü, həmin

[2507] Bakı nüsxəsi: "Fəzli".
[2508] Gücərat – indiki Hindistanın qərbində yerləşən ştat.
[2509] "Şəhid şod Məhəmməd Bayram" = 968 h.

ayın 17-də (19.07.1562) Səadətabad bağında onlar büsatı öpmək səadəti ilə baş ucalığı tapdılar və xondgarın xətti ilə [yazılmış] məktubu təqdim etdilər. Şah onlara növbənöv hüsn-rəğbət göstərdi. Bundan öncə [şah] Fərruxzad bəyi göndərərək xondgarla əhd-peyman bağlamışdı ki, bu iki tərəfin birindən hər kim digər tərəfə qaçıb sığınarsa, onu təslim edəcəklər. Ona görə də pəncşənbə günü, zilqədə [ayının] 21-də (23.07.1562) Sultan Bayəzidi övladları ilə birlikdə xondgarın istəyinə uyğun surətdə onlara təslim etdilər. Hamısını (Bayəzidi və dörd oğlunu) boğdular (öldürdülər). O hadisənin tarixi haqqında demişlər:

Misra

Beş [nəfər] azaldı "Osmanlı zümrəsi"ndən
(Pənc kəm əz "zümreyi-Osmaniyan")[2510].

Həmin ayın son günündə [elçilər] qətlə yetirilmişlərin cəsədləri ilə Ruma qayıtdılar.

Şeir

"Ey şah, yenə azdır sənə kim hər nə qədər şükr etsə,
Çünki ağılla, ədalətlə xalqı etdin asudə.
Din düşmənlərini sən elə məhv etdin ki sakitcə,
Nə əlin bulaşdı, nə də qılıncın oldu aludə".

### Müxtəlif əhvalatlar

Bu il Pir Məhəmməd xan Şirvani Sipəhr və Bürhanpur vilayətinə yollandı. Baz Bahadır onunla döyüşdü. Pir Məhəmməd xan suda qərq oldu. Ona görə də Baz Bahadır Məndar vilayətini ələ keçirdi. Elə ki bu xəbər Cəlaləddin Məhəmməd Əkbər şaha çatdı, Abdulla Xoca Müinəddini ağır bir ordu ilə Məndara göndərdi. Baz Bahadır müqavimət [göstərməyə] tab gətirməyərək cəngəllik tərəfə qaçdı. Bir müddət sonra o, aləmin pənahı olan dərgaha gəlib Fəridun şövkətli hökmdarın (Cəlaləddin Məhəmməd Əkbər şahın) qayğıkeşliyi ilə əhatə olundu.

Bu il, rəbiüssani ayının 17-də (25.12.1561) Ləvasanın[2511] oğlu Davud bəy bir dəstə aznavurla Gürcüstandan Qəzvinə gəlib müsəlman oldu. Dinin pənahı olan şah Tiflis hakimliyini ona verdi.

Bu il içində Əli sultan Özbək Xorasan ölkəsinin bəzi yerlərinə basqın edib Xarəzm tərəfə qayıtdı.

Bu il içində Qazaq öz qardaşı Hüseynqulu bəyi Həzarə vilayətinə basqın etməyə göndərdi. Onlar həmin diyarı çalıb-çapıb, çoxlu qoyunlar və mallar ələ keçirərək Herata qayıtdılar və həmin səfərdə onların ordusunda təxminən üç min at tələf oldu.

### Ölümlər

Bu il, çaharşənbə günü, gecə yarısında, cəmadiyüləvvəl [ayının] 14-də (20.01.1562) Şah İsmayılın qızı və dinin pənahı olan şahın doğma bacısı şahzadə Sultanım[2512] axirət aləminə köçdü[2513]. O, 925-ci ildə (1519) doğulmuşdu.

## 970-Cİ İLDƏ (31.08.1562 – 20.08.1563) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Ləvənd bəyin oğlu İsa xanın dustaq edilməsi

Ləvəndin oğlu İsa xan uca mərtəbəyə çatmışdı. O, bütün əmirlərdən və dövlət ərkanından irəlidə otururdu və hər il altı min tümən məbləğində ölkə (tiyul) və ənamlar onun üçün təyin olunmuşdu. Təsadüfən, bəzi məkrli müşriklərin təhriki və zəlaləti, kafir müfsidlərin hiyləsi və fırıldağı ilə pərişanlıq yazısını və islam dinindən xaric olmağı öz etiqadının alnına çəkdi. "Sizdən hər kəs öz dinindən dönüb kafir olaraq ölərsə, belə kimsələrin bütün əməlləri (vaxtilə gördüyü yaxşı işləri) dünya və axirətdə heçə gedər"[2514] [ayəsi] onun

---

[2510] "Zümreyi-Osmaniyan" ifadəsinin əbcəd hesabı ilə cəmi 974 edir. Misranın məzmununa uyğun olaraq, bu rəqəmdən 5 çıxdıqda 969 edir ki, bu da hicri təqvimi ilə həmin hadisənin baş verməsinin tarixini göstərir.

[2511] Ə.Nəvai (s.1425): "Luarsab daha doğrudur, lakin bütün nüsxələrdə belədir (Ləvasan yazılıb)".

[2512] Əsl adı Məhinbanu idi *(Nəvai, şərhlər, s.1426).*

[2513] Burada göstərilən miladi tarix çərşənbə gününə deyil, çərşənbə axşamına təsadüf edir.

[2514] *Qurani-Kərim, "Bəqərə" surəsi, 217-ci ayə.*

halının sübutuna çevrildi. Fərar etmək istədi. Onun yaxın mülazimlərindən biri bu hal-qəziyyəni dinin pənahı olan şaha məruzə etdi. Ona görə də çaharşənbə [gününün] axırında, rəbiüssani [ayının] 26-da (23.12.1562) onu dustaq edib Ələmut qalasına göndərdilər.

## Rum sultanının bac göndərməsi

Həmçinin bu il Rum padşahı Sultan Süleyman öz mülazimləri sırasından olan İlyas bəyi yaxşı töhfələrlə və rəğbət doğuran hədiyyələrlə, o cümlədən otuz min tümənə bərabər olan beş yüz min əşrəfi ilə və məxmər, zərbafta və qıpqırmızı çulları olan, əksəri daş-qaşlı və qızıl yəhərlərə malik qırx bədöv atla [Şah Təhmasibin hüzuruna] göndərdi. Hədiyyəlik atların arasında bir at vardı ki, ayaqları külək kimi [sürətli] idi, yüyürən zaman atəş kimi aşağıdan yuxarıya qalxar və su kimi yuxarıdan aşağıya enərdi.

Nəzm

“Aşağıya enən vaxt su kimidir,
Külək kimi şığıyar yuxarıya çıxan zaman.
Zümrüdi dırnağını döyüşdə qüvvətlə yerə döyər,
Gözlərini əfi ilan kimi zilləyər.
Sanki təqdir onun kölgəsində oturmuşdur,
Zəka süvarisi onun tozuna belə çata bilməz.
Zəmanə seyrinə çıxarsan bu gün belinə minsən,
O, səni elə bir aləmə aparar ki, orada sabah var”.

Elçilər səfər [ayının] 19-da (18.10.1562) Qəzvinə çatdılar. Əmirlər onların gəlişi [haqqında] xəbəri [şaha] ərz etdilər. Dinin pənahı olan şah bargahda qərar tutdu. Elçilər töhfələri təqdim etdilər. Dinin pənahı olan şah cəmi şahzadələrə, həzərata, bütün adamlara, təbəqələrə, əyan-əşrəfə və qorçulara dərəcələrinə uyğun surətdə nəfis töhfələrdən, əşrəfilərdən və qeyrilərindən hədiyyə etdi və Mavəraünnəhrdə olan özbək sultanlarından Bəlx hakimi Pir Məhəmməd xan, Buxara valisi Abdulla xan və Səmərqənd hakimi Sultan Səid üçün çeşidli ərməğanlar göndərdi.

## Müxtəlif əhvalatlar

Bu il Əmir Təqiəddin Məhəmməd İsfahani sədarətdən çıxdı. Zilqədə [ayında] (22.06-21.07.1563) İraq, Fars və Xuzistan sədarəti Astarabadın fəzilətli seyidlərindən olan Əmir Məhəmməd Yusifə həvalə edildi. Zilhiccə [ayının] (22.07-20.08.1563) ortalarında Şirvan, Xorasan və Azərbaycan sədarəti Əmir Əsədulla Mərəşinin oğlu Əmir Zeynəddin Seyid Əliyə verildi.

## Ölümlər

Qazıoğlu kimi məşhur olan Mövlana Qütbəddin Məhəmməd Bağdadinin ölümü. Mövlana Qütbəddin Bağdadi əqli və nəqli elmləri mənimsəmək sahəsində tay-tuşlarından çox irəlidə idi və [onlarla müqayisədə] hədsiz dərəcədə üstünlüyə malik idi. Dərrakəli zehni yəqinlik maarifinin qaranlıq məqamlarının kəşfedicisi və idraklı fəhmi dini məsələlərin müşküllərinin həlledicisi idi. Fəzilətlər və bilik sahibi olmaqla yanaşı, inşa və söz ustadlığı fənlərində bəlağət şüarlı münşilərin öndəgedəni idi. İbarələr bəzəmək üslubunda fəsahət əlamətli söz ustalarının rəhbəri idi. O, bəşər ustadı (ustadül-bəşər) Əmir Qiyasəddin Mənsurun tələbələri cümləsindən idi. Dinin pənahı olan şahın yanında çox hörməti vardı. Bu il o, Qəzvində əbədiyyət aləminə yollandı.

Mövlana Kəmaləddin Hüseynin oğlu Həkim Mövlana Nurəddin Məhəmməd əqli elmlərə yiyələnmək baxımından əsrin yeganəsi idi. Dəqiqlik məsələlərindən hansı məsələ barədə müzakirə və mübahisə düşərdisə, o, düzgünlüyün təsiri altında olan öz könül sandığından çıxardığı ürək oxşayan sərvətinin parlaq cavahiri ilə onu həll edərdi. Hansı incə məna haqqında söhbət düşərdisə, onu öz sağlam zehninin dürləri və inciləri ilə gözəllərin kəməri kimi bəzəyərdi. Onun ali fəhm və idrakının dərəcəsi o qədər yüksəkdir ki, iki dilli qələm

onun cüzi bir qismini belə bəyan edə bilməz. Onun kəlam elmində, xüsusən də təcriddə[2515] və [təcridin] haşiyəsində məharəti və təcrübəsi digər elmlərə nisbətən daha artıq idi.

Öz şərəfli atasından sonra o, dinin pənahı olan şahın təbibi təyin edilmişdi. Axırda o həzrət (Şah Təhmasib) vəkalət mənsəbini ona təklif etdi, [lakin] o, qəbul etmədi. Bu il, düşənbə günü, rəcəb [ayının] 27-də (22.03.1563) dünyadan köçdü. Mövlana Möhtəşəm Kaşi həmin hadisə haqqında [belə] deyir:

Nəzm

“Ey könül, nəzər et bu amansız fələyə,
Gör bu nə qədər çox zülmə mail olmuş.
Yer üzündə o dərəcədə qalmaqal saldı ki,
Zəminin işini bu zamanda müşkül etdi.
Əcəl o qədər cəsarətli oldu ki,
Zaman Məsihinin ağzına ölüm zəhəri tökdü.
Sultanların əmini, xaqanların həmsöhbəti,
Fəzilət cahanının maarif fəzası idi o.
O, bir Məsih nəfəslidir ki, nəfəsindən ruh getmiş,
Onun ruhu qurbanlıq quş şəklinə düşmüş.
Peyğəmbərin adaşı, dinin nuru, millətin ayı,
Mələk təbiətli, pak xasiyyətli Məhəmməd.
O, bir həkim idi ki, müalicəsi mətin sədd idi,
Həyatla əcəl arasında əngəl idi.
Şahbaz kimi yüksək aşiyanlı ruhu,
Alicənablıqla cahandan cənnətə saldı kölgə.
Onun vəfatının tarixi haqqında yazdılar,
Xatir dibaçəsinə və ürək səhifəsinə.
Müdrik hökmlü, “hikmət əhlinin sərvəri”
(“sərvəri-əhli-hikmət”) = 970,
Pənahlar fəzilətlisi, “fəzilətlilərin pənahı”
(“pənahi-əfazil”) = 970”.

## 971-Cİ İLDƏ (21.08.1563 – 08.08.1564) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Bəlx hakimi Pir Məhəmməd xan ibn Canibəy sultan qarışqa və çəyirtkədən artıq sayda bir ordu ilə İmam Rzanın [dəfn edildiyi] müqəddəs Məşhədə gəlib, dağıntı törətmədən öz diyarına qayıtdı və dayısı Tülək Bahadırı üzrxahlıq etmək üçün aləmin pənahı olan dərgaha göndərdi. Dinin pənahı olan şah, Hüseyn bəy Yasavulbaşını onunla birlikdə Bəlxə göndərdi. Pir Məhəmməd xanın getməsindən sonra Əli sultan Özbək qardaşı oğlu Əbülxanla ittifaqda Xorasana basqın etməyə gəldilər və Türüqdə dayandılar. Gələn kimi [özlərinə] yurd və məkan təyin etməklə məşğul oldular. Qızılbaş əmirlərindən Safi Vəli xəlifə Rumlunun, Qənbər sultan Ustaclunun və Sultan İbrahim mirzənin mülazimləri şəhərdən çıxıb düşmənlərə həmlə etdilər. Döyüş atəşi şölələnməyə başladı və savaş qığılcımı onların varlıq xırmanını yandırdı. Çoxlarını qətlə yetirdilər. Ulduzlar ordusunun şahı (günəş) hərbin qorxusundan məğrib hasarına girdikdən sonra hər iki güruh taqətdən düşdülər və yüyənlərini dartıb öz mənzillərinə tərəf tələsdilər. Əli sultanın ürəyini tam qorxu bürüdü. O, geri dönüş təbilini döyəcləyib öz diyarına yollandı. Elə ki İsfərayinə çatdı, döyüşə başladı və onun bir çox mülazimləri öldürüldü. Ona görə də xoflu və uğursuz bir şəkildə öz diyarına getdi.

### Müxtəlif əhvalatlar

Bu il dinin pənahı olan şah, Məsum bəy Səfəvini çoxlu ordu ilə Mazandaranı zəbt etməyə göndərdi. Əmir Murad xanı xeyli xof bürüdü. O, ulu dərgaha ərizə göndərib bildirdi: “Axı bizim nə cəsarətimiz və ixti-

---

[2515] Nəsirəddin Tusinin kəlam elmi haqında “Təcridül-etiqad” adlı əsəri vardır. Burada adı çəkilən alimin bu kitabı dərindən bildiyinə işarə edilmiş ola bilər.

yarımız vardır ki, qalibiyyətli qoşunların bir dəstəsinin qabağında dayana biləк?! Əgər məqsədiniz vilayətdirsə, onu kimə istəsəniz, təslim edərəm”.

Nəzm

“Onun tam tabeçiliyi məlum oldu,
Fələyin qulamlıq etdiyi şahın astanasına.
[Şah] ona təbil və ələm verib, rütbəsini yüksəltdi,
Ona kərəm etdi səadət tacını”.

Bu səbəbdən [şah] Mazandaran hakimliyini ona verdi.

Bu il dünya hökmdarları aləmin pənahı olan şahın dərgahına elçilər və hədiyyələr göndərdilər. O cümlədən Bəkkər[2516] valisi Sultan Mahmud xan, Əbülməkarim adlı birisini növbənöv hədiyyələrlə və cürbəcür töhfələrlə yolladı. Həmçinin Əbülxan peşkəşlər göndərdi. Dinin pənahı olan şah elçilərə dəyərli xələtlər bağışladı və onlara getmək üçün rüxsət verdi.

**Ölümlər**

Bu il dinin pənahı olan şahın bacısı Xanış xanım fani aləmdən əbədi cahana köçdü. Onun cəsədini əri Şah Nemətulla Kirmani Kərbəla torpağına aparıb, vəsiyyətinə uyğun şəkildə orada dəfn etdi.

Həmçinin bu il, Kərbəladan qayıtdıqdan sonra ali məqamlı, “vilayət”in pənahı, irşadın sığınacağı, hidayətin məzhəri, islamın dayağı, xalqın ümid yeri, əzəmətli sirlərin vaqifi, mənəvi tövrlərin kəşfedicisi, İlahi hərəmin məhrəmi, islam məmləkətlərinin bəyənilmişi Şah Nemətulla Kirmani böyrünü zəiflik yatağına qoydu. Xəstəliyin sərsəri yelinin əsməsindən qönçə kimi pəjmürdə oldu, ömür budağı faniliyin sərt küləyindən sındı. O həzrət, dinin pənahı olan şahın bacısının əri idi. Heç bir vüsal yoxdur ki, “Artıq aranızdakı [rabitə] qırılmış”[2517] [ayəsinin] zərurətinə uyğun olaraq sona çatmasın və heç bir məclis yoxdur ki, “Bu artıq mənimlə sənin aranda ayrılıq vaxtıdır”[2518] nidası orada iştirak edənlərin qulağına yetişməsin. Axı hansı uca qəsr və möhkəm təməl vardır ki, həlak bayquşu onun üzərinə oturmamış olsun?! Amma bir halda ki, “[Yer] üzündə olan hər kəs fanidir (ölümə məhkumdur)”[2519] mənasına əsasən, Adəm övladları zümrəsinin çöhrəsinə fanilik dağı vurulmuşdur və “Allahdan başqa hər şey məhvə məhkumdur”[2520] [ayəsinin] mahiyyəti vəfat və ölüm qapılarını törəyiş sahəsinin sakinlərinin (canlıların) üzünə açmışdır, matəmə batmışların canına dəyən dilxorluğun çarəsini “Yalnız [dünyada Allah yolunda çətinliklərə] səbr edənlərə [axirətdə] saysız-hesabsız mükafat veriləcəkdir!”[2521] şərbətxanasından gözləmək lazımdır və müsibətlə üzləşmişlərin ürəyində peyda olan hərarətin söndürülməsi “Onları Rəbbi tərəfindən bağışlanmaq və rəhmət (cənnət) gözləyir”[2522] ehsanının suyu ilə mümkündür.

Həmçinin bu il Rəşid xan ibn Olca xan ibn Yunis xan ibn Üveys xan ibn Şirəli ibn Xızır Xoca-oğlan ibn Toğluğ ibn Eyməl Xoca ibn Dəva xan ibn Büraq xan ibn Yosun Qara ibn Maməkan ibn Cağatay xan ibn Çingiz xan vəfat etdi. Bu şeir ona mənsubdur:

Beyt

“Çatmış mənə yarın gəlişindən xəbər bu gün,
Düşmüş şəhərə gör nə əcəb şurü-şər bu gün”.

Məmləkəti Kaşğar və Xötən idi. Ondan sonra oğlu Əbdülkərim xan onun yerinə keçdi.

---

[2516] Bəkkər (Bhakkar) – indiki Pakistanın Pəncab vilayətində bir bölgə.
[2517] *Qurani-Kərim, “Ənam” surəsi, 94-cü ayə.*
[2518] *Qurani-Kərim, “Kəhf” surəsi, 78-ci ayə.*
[2519] *Qurani-Kərim, “Rəhman” surəsi, 26-cı ayə.*
[2520] *Qurani-Kərim, “Qəsəs” surəsi, 88-ci ayə.*
[2521] *Qurani-Kərim, “Zümər” surəsi, 10-cu ayə.*
[2522] *Qurani-Kərim, “Bəqərə” surəsi, 157-ci ayə.*

## 972-Cİ İLDƏ (09.08.1564 – 28.07.1565) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Aləmin pənahı olan şahın Herata qoşun göndərməsi və Qazağın dustaq edilməsi

Bu il bu bargahın (Səfəvi xanədanının) yüksəltdiklərindən və bu dərgahın himayə etdiklərindən olan Qazaq nankor olub, Xeybər cühudları kimi başını itaət çənbərindən çıxararaq ayağını tabeçilik dairəsindən kənara qoydu və qəti surətdə nankorluq və üsyan mövqeyi tutdu. Onun beyinsiz başına pozğun xəyallar yol tapdı və bədşüküm könlündə Herat səltənətinin sevdası möhkəmləndi. Avaraçılıqdan bu ab-havanı və həvəsi ələkdən keçirdi, qiyamçılıq alovunu alışdırmaqla öz abır-həyasını yandırdı və [Səfəvilər] dövlətinin cəmi düşmənlərinin aqibətinin pisliyindən və əhvalının puçluğundan ibrət götürmədi. Onun gümanı bu idi ki, dinin pənahı olan şahdan başqa ona müqavimət edə biləcək və ona həmlə etməyə gücü yetəcək kimsə yoxdur. Ona görə də Heratı xaraba qoymaqla və bəndələrə əzab verməklə məşğul olub əksər rəiyyətləri şəhərdən və bölükatdan xaric etdi, onların mallarını və əşyalarını mənimsədi və əhalinin cəmiyyətinin binasını zülmün sərsəri [küləyi] ilə viran edib sitəm qapılarını rəiyyətin, məiyyətin və digərlərinin üzünə açdı. O, "Bir hökmdar küfr ilə qala bilər, lakin zülm ilə qala bilməz" hədisinin məzmunundan xəbərsiz idi. Bilmirdi ki, miskinin əlindən alınmış bıçaq dönüb peyğimbərin iti qılıncı olmaz, fəqirlərin malının vəsaiti hesabına düzəldilmiş qalxan qəzavü-qədər tüfənginə mane ola bilməz və məzlumların pulu ilə tərtib edilmiş cövşən (zireh) bəlanı dəf etməz.

Şeir

"Dul qadının əlindən üzüyünü almaqdansa,
Bacarırsansa, qeysərin barmağından üzüyü çıxar.
Bir hökmdar borc içindəki kasıbın kisəsi ilə deyil,
Xəzinə ilə öz kamına çatar".

Qazağın tüğyan etməsi [haqqında] xəbər dinin pənahı olan şahın qulağına çatdıqda onun qəzəb atəşi alışdı, qeyz qığılcımı yandırıcı alov kimi şölələndi və küləyin şiddətindən dənizin təlatümə gəldiyi kimi, onun hiddət seli coşdu. [Şah tərəfindən] cahanı müti edən əmr verildi ki, Sultan İbrahim mirzə, Bədiüzzaman mirzə, Məsum bəy Səfəvi, Əmir xan Türkman, Vəli xəlifə Şamlu, Şahqulu sultan Əfşar, Nəzər bəy Ustaclu, Sədrəddin xan Səfəvi, Araz bəy Rumlu, Heydər bəy Türkman, Əmiraslan bəy Əfşar və Xəlil bəy Kürd[2523] Herata yollansınlar, əvvəlcə onu tabeçilik göstərməyə, təslim olmağa və doğru yola riayət etməyə dəvət etsinlər. Əgər itaət boyunduruğunu və sədaqət halqasını bəzək və zinət kimi boynuna və qulağına taxarsa, səadət və uğur məkanı olan aləm dərgahına əyilməyi qəbul edərsə, [ixtiyarındakı] beş min süvarini [şah] ordusunun əmirlərinin sərəncamına verərsə, o zaman ona izzət və ehtiram göstərsinlər. Yox, əgər inadkarlıqda və üsyankarlıqda israr edərsə, onu dəf etməklə məşğul olsunlar. O əsnada Qazağın qardaşları Mustafa bəy və Müseyib bəy ona qəsd etdilər; lakin bir iş görə bilmədilər və ona görə də dövlətsevərlərdən [ibarət] bir dəstə ilə Herat şəhərindən çıxıb, Quryana gedərək, o diyarın valisi olan Safi Vəli xəlifə Rumluya qoşuldular.

O əsnada Qazaq öz qardaşı Hüseynqulu bəyi şeytanın tabeçilərindən [ibarət] pərişan bir dəstə ilə qardaşlarına və Safi Vəli xəlifəyə qarşı döyüşə göndərdi. Safi Vəli xəlifə ildırımdan və küləkdən daha cəld bir qasidi əmirlərin [yanına] göndərib [onları] Qazağın qoşununun gəlişindən xəbərdar etdi. Məsum bəy bu xəbəri eşitdikdə, xəncər vuran bahadırlardan [ibarət] bir dəstə ilə onların üzərinə sürətlə hərəkət etdi.

Düşənbə[2524] gününün sabahı [əmirlər] dəmir dağ və təlatümlü dəniz kimi bir qoşunla müxaliflərə yetişdilər. O vaxtadək Hüseynqulunun və Qazağın qoşunu arasında əmirlərin onlara tərəf hərəkət etməsi [haqqında] xəbər öz təsdiqini tapmışdı. Onların gəlişindən sonra [qiyamçılar] iztiraba düşüb qaçmağa üz qoydular. Qəzəbli qartalın şövkətindən heyrət girdabında qalmış su quşları kimi əndişə lövhəsinə fərar surətini çəkdilər. Amma ölüm qılıncının camından acı damla içməli və ox səfirindən can odlayan xəbər eşitməli olan bir dəstə qeyri-mümkün bir xəyalla döyüş və vuruş iddiasına düşüb savaş meydanı təyin etdi. Şənbə səhəri, rə-

[2523] Tehran nəşrinin bu yerində sadalanan əmirlərin adlarında əskikliklər olduğu üçün Baroda nəşri (II c., s.184) və Bakı əlyazması (245a) əsasında mətnə düzəliş edilmişdir.
[2524] Məclis nüsxəsi: "Çaharşənbə".

biülaxır [ayının] 10-da (15.11.1564)[2525] zəfər şüarlı əsgərlərin mənqəlayı müxaliflərə çatıb dərhal həmlə etdi. İlk həmlədə bahadırcasına hücum həyata keçirdilər və mərdanə səy göstərdilər. Hərb qığılcımı şölələndi və savaş alovu canların[2526] xırmanına ölüm atəşini saldı. Əcəlin sərt küləyi həyat fidanını mövcudluq bağçasından qopardı və döyüş dəryasının təlatümü nəticəsində ətrafda ölülərdən [ibarət] yığınların yaranması ilə böyük dəhşətin (qiyamətin) surəti göründü və məhşər çölünün nümunəsi müşahidə edildi.

Nəzm

“Torpaq kişilərin qanından dalğalandı,
Qalxanlar tabut oldu, cövşənlər kəfən oldu.
Qandan torpaq üstündə axdı döyüş seli,
Bu sel meydandan qaçanı da apardı.
Təbərzin zərbəsi ilə pəhləvanlar başı aşağı düşdü,
Fərhadın külüngündən Bisütun yıxılan kimi.
Qalxanlar tüfəngdən parça-parça oldu,
İldırımın zərbəsi ilə ağac parçalanan kimi”.

Qalibiyyətli qoşunun bahadırları o məğrur güruhun çərxçilərini yerindən dəbərdib [özlərini] mərkəzə yetirdilər və onlar qaziləri tüfəng zərbələri ilə geri oturtdular. O əsnada Vəli xəlifə Şamlu aslan xasiyyətli bahadırlardan bir dəstə ilə və dava axtaran pələnglərdən bir bölüklə mənqəlayın köməyinə çatıb bir həmlədə onları məğlub etdi. Qazağın qoşunu sürətli ox kimi və küləklə sovrulan tozanaq kimi üzünü fərara doğru çevirdi. Qalibiyyətli qoşun onlardan min səkkiz yüz nəfəri qətlə yetirdi. Onların fərar etməsindən sonra Sultan İbrahim mirzə və Məsum bəy Səfəvi kimi adlı-sanlı əmirlərin vücudu ilə möhkəmləndirilmiş qoşunun mərkəz hissəsi (qəlbi) döyüş meydanına çatdı və [orada] dayandı. Qazağın qoşununun qılıncdan qurtulanları özlərini savaş meydanından kənara çıxarıb, bəziləri çoxlu məşəqqətdən sonra şəhərə çatdılar. Digər bir qismi isə cahanın [müxtəlif] tərəflərinə səpələndilər. O cümlədən [Qazağın] böyük oğlu Cəfər bəy heyran, sərgərdan və pərişan bir halda atasını qoyub, qılıncdan qurtulanların bir dəstəsi ilə Bəlx tərəfə qaçdı və Pir Məhəmməd xanın yanına getdi. O, rədd əlini onun ümid sinəsi üzərində qoyduğundan, naçar şəkildə Hindistana yollandı.

Qoşununun məğlubiyyəti xəbəri Qazağa çatdıqda kədər və qəm qoşunu onun könlünü istila etdi və o, öz əhval səhifələri üzərində acizlik və zəiflik əlamətlərini müşahidə etdi. İstədi ki, öz qoşunu cəmləyib şəhəri müdafiə etsin, amma müyəssər olmadı.

Nəzm

“Əgər qoşun döyüşdə pərakəndə oldusa,
Onu yenidən cəmləşdirməyi bacarmaq müşküldür.
Bahar küləyindən tökülən çiçək,
Yenidən budağa cəm ola bilməz.
Bərk daşla sınarsa zərif büllur,
Onu heç bir usta düzəldə bilməz”.

O, əlacsızlıq və iztirab üzündən ali mənşəli şahzadə Sultan Məhəmməd mirzə və Sultan Hüseyn mirzə ilə İxtiyarəddin qalasına gedib başını narınqalanın içinə soxdu və dəniz kimi coşan qoşunun qorxusundan heyrət dəryasına qərq olub qurtuluş sahilinə yol tapa bilmədi. Nəhayət, Məsum bəy tənha şəkildə o qalaya gedib Sultan Məhəmməd mirzəni oradan çıxardı. Axırda Qazaq acizlik və biçarəlik üzündən dəlisovluğu tərk edib cümə gününün əsr vaxtında, rəbiülaxır [ayının] 16-da (21.11.1564)[2527] qaladan çıxdı. Əmirlər onu bir məkanda dustaq etdilər. Bu xəbəri ali taxtın ətəyinə məruzə etdilər. O, Herat əhlinə qarşı törətdiyi sitəmkarlığın və zülmkarlığın uğursuzluğu ucbatından cürbəcür müsibətlərə və gündən-günə artan bəlalara giriftar oldu. “Zülm edənə əzab verəcəyik”[2528] zərurətinə uyğun olaraq, asimandan gələn qəziyyələrin hökmü ilə bu hal

[2525] Miladi təqvimlə həmin gün çərşənbəyə təsadüf edir.
[2526] Baroda nəşri: “xanların”.
[2527] Məclis nüsxəsi: “12-də”. Həmin il rəbiülaxır ayının 16-sı cümə gününə deyil, şeşənbə gününə, 12 rəbiülaxır isə cümə gününə təsadüf etmişdir.
[2528] *Qurani-Kərim, “Kəhf” surəsi, 87-ci ayə.*

əsnasında, hələ bunlar baş verməzdən öncə Qazaq istisqa[2529] xəstəliyinə mübtəla olmuşdu. Həmin vaxt o rəzilin ruh quşu əcəl toruna düşdü, əyyamın əli onun həyat səhifəsi üzərinə bitmək və tükənmək ayəsi yazdı və bir gün neçə-neçə varlıq mismarı ilə tikilmiş ömür gəmisi fanilik sahillərinə çatdı. Əmirlər onun şərlə dolu başına saman təpib aləmin pənahı olan dərgaha göndərdilər və həmin cənnət misallı şəhərdə (Heratda) qışlaq etdilər.

**Dəkən vilayətində baş vermiş hadisələr haqqında söhbət**

Bu il Bicanəgər padşahı Çəndray[2530] Dəkən hakimlərinin yanına bacarıqlı elçilər göndərdi və onların vilayətlərindən bəzi yerləri tələb etdi. Ona görə də həmin diyarın valiləri bir-birilərinə elçilər və məktublar göndərdilər və öz aralarında ittifaq bağladılar. Nizamşah cövşən geyən ordu, hədsiz sayda fillər və saysız-hesabsız piyadalarla Əhmədnəgər bölgəsindən çıxıb Adilşah və Qütbşahla[2531] ittifaqda üzüqara kafirlərin üzərinə hərəkətə başladı. Elə ki bu möhnətli xəbər Bicanəgər racasına çatdı, rəvan qumdan və biyaban qarışqasından daha artıq sayda qoşunlarla birlikdə mücahidlərlə qarşılaşmağa tələsdi. Alçaq kafirlərin hərəkətindən xəbərdar olan islam ordusu Qanq çayını keçib onların qabağında dayandı.

Şeir

“Elə ki sübh dəmi bu çevik yüyənli şah (günəş),
Tutdu cahanı qılınc və nizə ilə.
Çalğıçı hər tərəfdən döyüş sazını çaldı,
Lərzəyə gəldi bu mavi rəngli günbəz (asiman)”.

Ordu sərdarları və dərgah böyükləri hər iki tərəfdən mükəmməl olub ordu səflərini tərtib etdilər. Çəndray yüz min süvari, yaxşı silahlanmış iki yüz min piyada və beş min zəncirli fillə Dəkən hakimlərinə doğru üz tutdu. Nizamşah mərkəzdə (qəlbdə) qərar tutmuş, səadətli meymənəyə Adilşahın vücudu ilə bəzək verilmiş və meysərədə Qütbşah dayanmışdı. İlk öncə iki tərəfin piyadaları bir-birilərinə hücum çəkib döyüşə başladılar. O zaman iri cüssəli bir fil islam ordusuna cumdu. Qütbşahın fili ona qarşı gedib müqavimət göstərdi. İslam qoşunları hamısı birdən şeypur çalıb kafirlərə həmlə etdilər və böyük bir döyüş baş verdi. O savaşın dəhşətindən mavi səma sarı gül rənginə büründü (saraldı) və iti qılıncın qorxusundan adlı-sanlı dilavərlərin öd kisəsi suya döndü (zəhri yarıldı).

Beyt

“Ordunun tozu fələyə o qədər çox qalxdı ki,
Hindlilərin bəxt ulduzu qaraldı”.

Dava-qırğın əsnasında Nizamşahın fili Qütbşahın filinə yardıma getdi. Çəndrayın filini tam vahimə bürüdü, o, qaçmağa üz qoydu və onun dişi Çəndraya dəydi. O kafir izzət atından zillət torpağına düşdü. Ona görə də islam qoşunu cəsarətlənib, təkbir (“Allahu-əkbər”) və təhlil (“La ilahə illəllah”) avazını fələyə çatdıraraq onlara qılınc vurdu. Hindlilərin qoşunu onlara [müqavimət göstərməyə] tab gətirməyib döyüş meydanından qaçış biyabanına üz qoydu. İslam qoşunu onlardan təxminən beş min nəfəri qətlə yetirdi. Çəndrayı əsir tutub Nizamşahın nəzərləri qarşısına gətirdilər. [Nizamşah] hərçənd ona kəlmeyi-şəhadət söyləməyi məsləhət görsə də, o, son dərəcə bədbəxtliyi və cəhaləti ucbatından qəbul etmədi. Bu səbəbdən o, Nizamşahın fərmanı ilə öldürüldü. Həddən və miqdardan artıq sayda xeyli mallar çoxsaylı əsgərlərin əlinə keçdi. İslam hakimləri Bicanəgərə yollandılar və o vilayəti soyub qarət edərək xaraba qoydular. Neçə-neçə nar dənə-

---

[2529] İstisqa – bədən boşluqlarına su toplanma xəstəliyi, sulu şiş.

[2530] Çəndray (Çandray) – Hind monarxlarının ümumi adı kimi işlədilir. Burada haqqında bəhs edilən Bicanəgər hökmdarı Rama Raca olmalıdır. Bicapur hökmdarı Əli Adilşah, Əhmədnəgər hökmdarı Nizamşah, Qolkonda və Bidar hökmdarları ilə birlikdə ona qarşı ittifaq yaratmışdılar. Onlar arasında döyüş 1564-cü ildə Krişna çayı sahillərindəki Talikot adlı yerdə baş vermişdir. Nəticədə, müsəlman hökmdarlar Bicanəgəri fəth etmiş və oranı tamamilə dağıtmışdılar *(Seddon, şərhlər, s.286).*

[2531] Adilşah – 1489-1686-cı illərdə Hindistanın Dəkən yaylasında mövcud olmuş Bicapur sultanlığını idarə edən Adilşahlar sülaləsinin hökmdarlarının titulu. Adilşahlar tük mənşəli idilər və onların paytaxtı Bicapur şəhəri idi *(СИЭ, т. II, Москва, 1962, с.435; Jean-Paul Roux. Türklerin tarihi: Pasifik'ten Akdeniz'e 2000 yıl. İstanbul, 2007, s.353).* Burada haqqında bəhs edilən Adilşah I Əli 1558-1580-ci illərdə hökmranlıq etmişdir.

Qütbşah – Hindistanın Dəkən yarımadasında, paytaxtı Heydərabad olan Qütbşahlar sülaləsi hökmdarının titulu. 1512-1687-ci illərdə hökm sürmüş Qütbşahlar sülaləsi Qolkonda sultanlığını idarə edirdi *(СИЭ, т. VIII, Москва, 1965, с.334).* Qütbşahlar sülaləsinin nümayəndələri Azərbaycanın Qaraqoyunlu sülaləsinin nəslindən idilər (bax: *Ч.А.Стори. Персидская литература, ч. II, с.844*).

sinə bənzər yaqut, Bədəxşan ləli və məlahətli zümrüdlər həmin çoxsaylı ordunun əlinə düşdü. Xəyal mühasibi [bu qənimətləri] saymaqda aciz və qüsurlu olduğunu etiraf etdi. Onlar o diyarda sakin qoymayıb öz vilayətlərinə qayıtdılar.

**Müxtəlif əhvalatlar**

Bu il Pəhləvan Qumri Xəbuşan qalasını əzəmətli qazilərin əlinə təslim etdi. Bu hadisənin təfsilatı belədir ki, bundan öncə Əli sultan o şəhəri ələ keçirmişdi. Bu il Mir Şəhriyar adlı-sanlı adamlardan [ibarət] bir dəstəni orada qoyub Əli sultanın dərgahına yollandı. Onun [Xəbuşanda] olmadığı zaman Pəhləvan Qumri darvazanı bağladı, onun bəzi adamlarını qətlə yetirib bir qismini [şəhərdən] çıxardı və qalanın açarlarını aləmin pənahı olan dərgaha göndərdi. Əli sultan bir dəstə özbəklə qala ətrafına gəlsə də, döyüşsüz öz diyarına qayıtdı. Dinin pənahı olan şah ölkəni və kilidi ona (Pəhləvan Qumriyə) həvalə etdi.

Həmçinin bu il dinin pənahı olan şah məmaliki-məhrusənin cəmisi təxminən otuz min tümən edən bütün tamğasını bağışladı (ləğv etdi).

Beyt

“Tamğanın ləğvi ilə tamğaçıya çəkildi dağ,
Həmin dağdan savayı, qalmadı tamğadan soraq”.

**973-CÜ İLDƏ (29.07.1565 – 18.07.1566) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT**

**Əmirlərin Əbivərd qalasını mühasirə etməsi**

Elə ki bahar sultanı ağacların və nəbatatın bətnində, budaqlarında və kökündə yerləşən və qışlaq etməklə məşğul olan hüceyrələri hərəkətı gətirdi, bahar küləyinin fərraşları çöllərin büsatında çiçəklərin və reyhanların rəngarəng çadırlarını, lalə və nəsrinin laybalay alaçıqlarını ağacların sütununa su kəndirləri ilə bərkidərək onlara yüz cür təravət bəxş etdilər.

Beyt

“Bahar sultanı yenidən,
Çölə və dağa çadır qurdu.
Yaşıllıq və gül ordusu peyda oldu,
Bostana təravət gəldi.
Uca sərv bayrağını qaldırdı,
İldırım gurultu ilə şeypur çaldı”.

Qızılbaş əmirləri Əmir Qeyb bəyi Heratda qoyub hərəkət bayrağını Nisa və Əbivərd tərəfə yüksəltdilər. Əbülxan zəfər nişanlı qoşunların yaxınlaşmasından xəbər tutdu və bildi ki, müqavimət [göstərməyə] taqəti yoxdur. Bu səbəbdən o, öz abır-həyasını qoruyub, sel güzərgahından (sel kimi gələn qoşunun qarşısından) qalxdı və Əbivərd qalasına sığındı. Ali məqamlı əmirlər qalanı fəth etməyi qarşıya məqsəd qoydular. Onlar qala ətrafına gəldikdən sonra mühasirəyə və müharibəyə başladılar. Özbək ordusu da müdafiə olunurdu. Əbülxan öz əhval səhifələri üzərində acizlik və əlacsızlıq əlamətlərini müşahidə etdi. Onun qəlbini böyük bir xof və tam dəhşət bürüdü. O, Xorasana basqın etməsindən peşman olub, bəyan sehri ilə ürəklərdən vəhşət düyününü açan, lətif hiylələrlə razılıq quşunu havadan aşağı endirib tora salan, yaxşı nitq qabiliyyətinə malik olan elçiləri əmirlərin yanına göndərərək aman dilədi və and içdi ki, bundan sonra basqınçılığı tərk edib hər il aləmin pənahı olan dərgaha peşkəş göndərəcəkdir. Ona görə də əmirlər qala ətrafından köç edib aləmin pənahı olan dərgaha yollandılar.

**Ölümlər**

Əli sultan ibn Ulus xan ibn Məhəmməd Əmin ibn Yadigar ibn Təmərşeyx-oğlan ibn Hacı Tuli-oğlan ibn Ərəb-oğlan ibn Fulad-oğlan ibn Aybə Xoca ibn Toğtay ibn Bolğan ibn Şeyban ibn Cuci ibn Çingiz xan. Əli sultan alçaqların hamisi, oğru və quldurun sərdarı olan bir padşah idi[2532].

Beyt

“Nə bir adam vardı ki, ondan xatiri asudə olsun,
Nə bir kimsə vardı ki, onun xətrini istəsin”.

Onun zülm tüğyanı dövran səhifələri üzərində günbəgün daha aydın görünürdü. Onun qeyri-mümkün[2533] istəklərinin, ağır müsadirə və vergilərinin söhbəti Xarəzm vilayətinin hər tərəfində yayılmış, ürəklərin tüstüsü alışmış, sinələrin yanğısı odlanmışdı. Bu səbəbdən o, həyat xırmanına bəla atəşi salmış oldu. Bu il o, Astarabada basqın etmək, şəhərləri dağıtmaq və bəndələrə əzab vermək iradəsi ilə Xarəzmdən çıxdı. ... mövqeyində[2534] dayandı. Qəflətən onun ömrünün kitabı əcəl xətminə yetişdi və əyyam hadisələrinin bəlasından həyatının mürəkkəbi başa çatdı. Onun ölümündən sonra Hacım xan onun vilayətini ələ keçirdi və Xarəzm behişt kimi rövnəqləndi. Sevinc gətirən mehin əsməsindən o pərişan şəhər firavan cənnət kimi çiçəkləndi.

**974-CÜ İLDƏ (19.07.1566 – 07.07.1567) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT**

**Dinin pənahı olan şahın Sultan Məhəmməd mirzəni Herata hakim göndərməsi**

Bu il dinin pənahı olan şah Herat hakimliyini Sultan Məhəmməd mirzəyə verdi və Yegan Şahqulu Ustaclunu o cənabın lələsi [təyin] etdi. Onlar Qəzvindən çıxıb Xorasana tərəf yönəldilər. Bu xəbər Mavəraünnəhrə çatdıqda, Buxara padşahı İsgəndər xan öz oğullarını və əmirlərini toplayıb Xorasan vilayətinə basqın barəsində onlarla məşvərət etdi. O səadətsizin əmirləri və dövlət ərkanı ərz etdiər ki, “səfər məşəqqətinə qatlaşaq və Sultan Məhəmməd mirzəyə həmlə edək”. Onun övladlarının ən böyüyü və ən şücaətlisi Abdulla xan idi.

Şeir

“Öz atasının önündə dilə gəldi,
Ürəyi kinlə dolu idi, belində kəmər vardı.
[Dedi] ki, aslanlar savaşının yaraşığı mənəm,
İran sərdarının rəqibi mənəm”.

İsgəndər xanın fərmanına əsasən, o, sel kimi qorxunc, dərya kimi şövkətli olan çoxsaylı bir ordu ilə Amudərya çayını keçib Xorasan vilayətinə gəldi. Həmin ordunun hərəkəti [haqqında xəbər] ali məqamlı şahzadəyə çatdıqda əsgərlərin əksəriyyəti dağınıq vəziyyətdə olduğu üçün Türbət qalasına[2535] pənah apardı. Özbək qoşunları qala ətrafına gəldilər və qalanın giriş-çıxış yollarını bağladılar. Neçə gündən sonra mühasiblərin fəhminin və katiblərin düşüncəsinin hesablamaqda aciz olduğu qədər ucsuz-bucaqsız qoşunlarla Xorasan əmirləri döyüş və vuruş meydanına yollandılar ki, iti qılıncın köməyi ilə qürur küləyini Abdulla xanın beynindən çıxarsınlar. O əsnada Mustafa bəy Varsağın oğlu Şüca bəy və mülazimi Murad bəy döyüş günü dilavərlərindən iyirmi nəfərlə birlikdə vuruşa-vuruşa özlərini qalaya saldılar. Özbəklər qorxaq və hürkək olub, qalanı fəth etməkdən ümidlərini üzdülər. İlk öncə Xosrov sultan köç edib öz diyarına yola düşdü. Ertəsi gün Abdulla xan geri qayıdış təbilini döyəcləyib, hərəkət, bəlkə də, qaçış bayrağını Buxaraya tərəf yüksəltdi. Mürğab çayının kənarına çatdıqda, [onun üzərindəki] körpünü xarab edib köçhaköçlə Buxaraya getdi. Mirzə həzrətləri mühasirə darısqallığından xilas olub Herata yollandı.

[2532] Baroda çapında Əli sultanın xüsusiyyətləri arasında onun “alçaqların hamisi” olması ilə yanaşı, “qantökən, qorxmaz, insafsız və harami” olması da qeyd edilmişdir.
[2533] Baroda nəşri: “qeyri-məhdud”.
[2534] Bu yerin adı mətndə boş buraxılmışdır.
[2535] Türbəti-Heydəriyyə və ya sadəcə Türbət – İranın Xorasan vilayətində, Məşhəd və Cünabəd şəhərləri arasında yerləşən tarixi qala.

**Rum padşahı Sultan Süleymanın Firəng tərəfə qoşun çəkməsi haqqında söhbət**

Elə ki Novruzda cahanı işıqlandıran günəş Qoç bürcündə mənzil tutdu, çəmənliklərdə novbahar küləyi əsdi və günəşin şəfəqindən yaşıllıq və reyhanlar boy atmağa başladı.

Nəzm

“Elə ki qış getdi və Novruz oldu,
Çəmənin havası könül oxşadı.
Yerə tökdü ildırım üfüqdən savaş kosunu,
Hərəkətə gəldi iki rəngli asiman.
Yerə tökdü asiman dolu oxunu,
Göy qurşağıdır onun kamanının kirişi.
Asiman savaşında basqın etmək istəyi ilə,
Fələk parlaq ulduzları nizə kimi oynatmağa başladı.
Fələyin zirvəsindən ox yağdırırdı bulud,
Qorxusundan tutmuşdu dəniz köpükdən qalxan.
Reyhanlar tərtib etdilər qoşunlarını,
Sipər oldu gül və qübbə oldu nilufər”.

Rum padşahı Sultan Süleyman çoxlu ordu və sonsuz qoşun cəmləyib kafirlər diyarına tərəf yola düşdü. Yol əsnasına Pərtöv paşanı çoxsaylı qoşunların bir dəstəsi ilə Gölə qalasını[2536] fəth etməyə göndərdi. Adı çəkilən paşa o qalanı tutub orduya qayıtdı. Sultan Süleyman Sigetvar qalası[2537] ətrafında əzəmət və iqtidar çadırını dövr edən fələyin zirvəsinə yüksəltdi. Çoxsaylı əsgərlər qalanı mərkəz kimi dövrəyə aldılar. O, elə bir qala idi ki, uca dağ başında yerləşirdi. Onun mətanət və istehkamı üfüqlərdə şöhrət tapmışdı. Möhkəmlikdə İsgəndər səddinin abır-həyasını aparmışdı. O qədər uca idi ki, onun əli Nahidənin (Zöhrə ulduzunun) kəmərbəndinə çatırdı.

Nəzm

“Bu, şövkətli və hündür bir dağ idi,
Fələyin damına kölgə salırdı.
Onun qartalı günəşlə birgə qanad çalırdı,
Pələngi asimanın pələngi ilə qonşu idi.
Fələk onun ətrafındakı təpə kimi idi,
Hansı ki, onun ətəyinin tozundan əmələ gəlmişdi”.

Rum ordusunun mübarizləri hər tərəfdən hücum edib, top və tüfəng atmağa başladılar.

Beyt

“Atəş saçdı tüfəng bu köhnə tağdan,
Tüstüsündən fələk qaranlıqda, ay məhaqdadır”.

Rumilər hərçənd səy göstərsələr də, qalanın fəthi nişanələri və zəfər əlamətləri zahir olmadı. Dərgah əmirləri və uca məqamlı paşalar qalanın alına bilməməsindən sıxıntıya düşdülər. Axırda o möhkəm səddin altından lağım vurdular, onun içini barıtla doldurub odladılar və bürclərin şəxsi heyəti təlaşa qapıldı.

Şeir

“O fitnə atəşindən hasar bürcü,
Qızardı nar gülləri kimi.
O qalada təşvişə düşdü hamı,
Cəhənnəm əhli kimi hamısı atəşdə idi.
Hasar atəşdən elə xarab oldu ki,
Sanki təcəlla nurundan aşağı töküldü Tur”.

---

[2536] Gölə (Gyula) – Tarixi Transilvaniya vilayətində, Timişvara şəhəri yaxınlığında bir qala *(A.Ergün. Üç kıtanın hâkimi Kanuni Sultan Süleyman. İstanbul, 2009, s.134).*

[2537] Sigetvar – Macarıstanda tarixi qala.

Rumilər iti qılınc zərbəsi ilə kafirlərin çoxunu cəhənnəmə göndərdilər. Onların əlinə çoxlu mallar düşdü. Fəthdən öncə Sultan Süleyman vəfat etdi. Bundan xəbərsiz olan qoşunlar qalanı tutdular[2538].

**Ölümlər**

Sultan Süleyman ibn Sultan Səlim ibn Sultan Bayəzid ibn Sultan Məhmməd *Fatehi-İstanbul* ibn Sultan Murad ibn Sultan Məhəmməd ibn Sultan *İldırım*[2539] Bayəzid ibn Sultan Murad ibn Orxan ibn Sultan Osman ibn Ərtoğrul ibn Süleyman şah ibn Qaya Alp. Onun nəsli neçə vasitə ilə Oğuz xana çatır. Sigetvar qalası ətrafında olan vaxt xəstəlik təzahürü onun zatının cövhərini bürüdü. Zaman-zaman xəstəliyi artdı və saatbasaat o halətin şiddəti yüksəldi. Nəhayət, həmin yaxşı xasiyyətli padşah kiçiyin və böyüyün (kiçikli-böyüklü hər kəsin) zatına vacib olan o qaçılmaz hadisəyə (ölümə) könül verib, vəziri-əzəm Məhəmməd paşanı çağıraraq ona Rum diyarı haqqında vəsiyyət etdi və Sultan Səlimi vəliəhd[2540] [elan] edib axirət aləminə yollandı.

Həyatının müddəti yetmiş dörd il və səltənətinin zamanı qırx səkkiz il idi. Məmləkəti: İraqi-Ərəb, Bəsrə, Diyarbəkr, Gürcüstandan Daveli, Zülqədər diyarı, Hələb, Şam, Misir, Qaraman, Təkkə eli, Sivasdan və Toqatdan ibarət Anadolu, Məğribdən Trablis[2541], Cəzirə, Hicaz, Yəmən, Ədən, Qətif[2542] və Kəfə. İstanbuldan ta Peç qalasına[2543] qədər onun hakimiyyəti altında idi.

Elə ki bu çox böyük hadisə baş verdi, Məhəmməd paşa [Sultan Süleymanın] ölümünü gizlədib, iş bacaran adamları Kütahyaya göndərərək Sultan Səlimi çağırdı. [Sultan Süleymanın] cəsədini məxfi surətdə İstanbula göndərdi ki, onu qaydaya uyğun olaraq, həmin məsələdən ötrü düzəldilmiş olan günbəzdə dəfn etsinlər. Sultan Səlim ildırım və külək kimi Ədirnəyə yollandı. İstanbula çatdıqda, öz adına xütbə oxudub yola düşdü. Elə ki Ədirnə ətrafına yetişdi, ordunun əksəriyyəti onu qarşılamağa tələsdi. Sultan Səlim orduya qoşulan kimi Sultan Süleymanın vəfatını aşkar (bəyan) etdilər və Sultan Səlim Ədirnə tərəfə qayıtdı.

Bu qövmdən on üç nəfər səltənət sürmüşdür: Sultan Osman, Orxan, [Sultan Murad], İldırım Bayəzid, Əmir Süleyman, Musa Çələbi, Sultan Məhəmməd, Sultan Murad, Sultan Məhəmməd, Sultan Bayəzid, Sultan Səlim, Sultan Süleyman[2544]. Onların səltənət müddəti hicri tarixinin 980-ə (1572/73) çatdığı indiki ilə qədər iki yüz doxsan bir ildir.

Dinin pənahı olan şahın bacısının əri Abdulla xan ibn Qaraxan Ustaclu bu il Şirvanda hərəkət bayrağını axirətə tərəf yüksəltdi (vəfat etdi)[2545].

**975-Cİ İLDƏ (08.07.1567 – 25.06.1568) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT**

Bu il Simaun bəy Ləvasan oğlu çoxlu süvari və saysız piyada cəmləyib Tiflisə yollandı. Bu xəbər o diyarda yayıldıqda, dinin pənahı olan şahın tərəfindən həmin qalanın hakimi olan Davud bəy Ləvasan [oğlu] cövşən geyən bahadırlardan [ibarət] bir dəstə ilə qardaşını dəf etməkdən ötrü şəhərdən çıxıb döyüşə və vuruşa hazır oldu. Səflər bir-birinə yaxınlaşan zaman İbrahim xəlifə Qaramanlu cəhalət və nadanlığının çoxluğu ucbatından az adamla Simauna qarşı döyüşə getdi. Hərçənd digər aznavurlar (Davudun əsgərləri) onu [bu fikirdən] daşındırmağa çalışaraq, "az qoşunla bu azğın tayfaya qarşı vuruşmağın məsləhət deyil" desələr də, o, bunu qəbul etməyib onlara (Simaunun ordusuna) həmlə etdi və aznavurların (Simaunun əsgərlərinin) zərbəsi ilə öldürüldü. Davud bəyin mülazimləri "Bu gün bizim Calut (düşmən tərəfin hökmdarı) və onun qoşunu ilə vuruşmağa taqətimiz yoxdur"[2546] deyə fəryad edərək əksəriyyəti ondan uzaqlaşdı. [Davud] özü naçar [halda] qaçış yolunu tutdu və Tiflisə gəldi. O, yenidən çoxlu ordu toplayıb Hüsam bəy Qaramanlu ilə ittifaqda savaş

[2538] Sultan Süleyman 1566-cı ilin sentyabr ayının 6-dan 7-nə keçən gecə vəfat etmiş, ertəsi gün, 21 səfər 974 / 7 sentyabr 1566-cı ildə Sigetvar qalası bundan xəbərsiz olan Osmanlı ordusu tərəfindən fəth edilmişdir *(A.Ergün. Üç kıtanın hâkimi, s.134-135).*
[2539] Bakı nüsxəsi (250b).
[2540] Vəliəhd – bir padşahdan və rəhbərdən sonra onun yerinə keçib səltənət və rəhbərlik taxtına oturan şəxs; hökmdarın varisi.
[2541] Trablis – Liviyanın paytaxtı olan Tripoli şəhəri nəzərdə tutulur.
[2542] Qətif – indiki Səudiyyə Ərəbistanının şərqində, İran körfəzi sahilində şəhər.
[2543] Peç – Macarıstanın paytaxtı Budapeşt o zamanlar Buda və Peşt adlı iki hissədən ibarət idi. Peşt şəhərinə türklər Peç deyirdilər.
[2544] Həsən bəy Rumlu burada on iki sultanın adını çəkir və on üçüncüsü kimi Sultan Süleymanı əvəz etmiş Sultan II Səlimi nəzərdə tutur. Diqqəti çəkən haldır ki, müəllif İldırım Bayəziddən sonrakı pərakəndəlik dövrünün iki hökmdarını (Əmir Süleymanla Musa Çələbini) da rəsmi sultan hesab edir.
[2545] Abdulla xan Ustaclu həm də Şah Təhmasibin bibisi oğlu idi.
[2546] *Qurani-Kərim, "Bəqərə" surəsi, 249-cu ayə.*

meydanına yollandı. Xeyli çalış-vuruşdan sonra məğlub olub Tiflis qalasına pənah apardı. Simaun qalanı dövrəyə alsa da, bir neçə gündən sonra qayıdış təbilini döyəcləyib öz diyarına yola düşdü.

### Müxtəlif əhvalatlar

Bu il Rum padşahı Sultan Səlimin Məhəmməd adlı elçisi tam şövkətlə Qəzvinə gəldi və əhd-peymanın doğru və möhkəm yoluna sədaqət və mətanət izharından ibarət məktub gətirdi. Onu qonaq etdikdən sonra hörmətlə, izzətlə və ənamla geri göndərdilər.

Bu il Rum padşahı Sultan Səlim, İsgəndər paşanı çoxlu qoşunla Cəzairi fəth etməyə yolladı. Çünki onlar Bəsrə nahiyəsinə basqın etmişdilər. Adı çəkilən paşa qalibiyyətli qoşunla Cəzair ətrafına gəlib çatdıqda onların hakimləri iş bacaran elçiləri çoxbilmiş paşanın yanına göndərdilər. [Elçilərin] sözlərinin məğzi bu idi: “Bizim valilərimiz deyirlər ki, biz Sultan Səlimin bəndəsi və nökəriyik. Baxmayaraq ki, bundan öncə pis bəxtimizin yol göstərməyi ilə ayağımızı tabeçilik dairəsindən kənara qoymuşduq və vəfa çöhrəsini müxaliflik dırnağı ilə cırmışdıq, indi xoşagəlməz əməllərimizə görə təəssüflənirik və peşmanlıq keçiririk. Əgər paşa[2547] bizim günahımızı bağışlayarsa, bundan sonra ayağımızı itaət yolundan kənara qoymarıq və hər il dövlət xəzinəsinə (xəzaneyi-amirə) on beş min flori məbləğində [vergi] verərik”. Buna görə də İsgəndər paşa Bağdada döndü.

### Böyük əmirlərin və müzəffər qazilərin əli ilə Gilanın fəth edilməsi haqqında söhbət

Bu il Gilan valisi Xan Əhməd zəlalət bələdçisinin yol göstərməsi ilə cürət və cəsarət qədəmini müxaliflik və tüğyan vadisinə qoydu və başını inadkarlıq yaxasından çıxarıb müxaliflik üzündən uzlaşmanın qarşısına sipər çəkdi. Baxmayaraq ki, sözügedən şəxs və onun ata-babaları bu dövlətə (Səfəvilər dövlətinə) bac vermiş və itaət etmişdilər. Hərçənd onu növbənöv nəsihətlərlə dolu və cürbəcür öyüdlərlə əlaqəli olan misallar və hökmlərlə tənbeh etsələr də, faydası olmadı. O, süni bəhanələr və ağılsız sözlərlə özünü təmizə çıxarmağa çalışdı.

Şeir

“Nadana nə qədər öyüd versən də, xeyri yoxdur,
Su üstünə nəsihət yazmaq mümkün deyil.
Kar öz avazından bir nəsib ala bilməz,
Təbibin əlacının ölüyə heç bir səmərəsi olmaz”.

O dövlətsizi yola gətirmək üçün ali taxtın ətəyindən göndərilmiş Həsən bəy geri qayıtdı və onun müxalifliyini müşahidə etdiyi tərzdə məruzə etdi. Ona görə də [şahın] cahanı yandıran qəzəb atəşi şölələnməyə başladı. [Şah] Əmirə Sasanı bir dəstə əsgərlə Kəsgərə göndərdi. Çünki Xan Əhməd onu (Əmirə Sasanı) o diyardan xaric etmişdi. Əmirə bir dəstə igidlə qəflətən Kəsgərə daxil oldu. O zaman Xan Əhmədin tərəfindən o diyarın valisi olan Sipəhsalar Səid qarşıdurma və vuruşma qədəmi ilə irəli gəldi. Gərgin döyüş baş verdi. Əmirə qüdrətli dövlətin gücü ilə ona qalib gəldi və Sipəhsalar Səidi bir dəstə mülazimlə birlikdə gedər-gəlməzə göndərdi. Bu xəbər dinin pənahı olan şahın qulağına çatdıqda Sədrəddin xan Səfəvini süvarilər dəstəsi ilə Rəştə tərəf yolladı. O zaman Xan Əhmədin tərəfindən o diyarın valisi olan Kiya Rüstəm özündən başqa kimsəni nəzərə almırdı. Sözügedən şəxs (Sədrəddin xan) qəflətən ona hücum edib, Kiya Rüstəmi bir dəstə süvari ilə birlikdə əsir alaraq aləmin pənahı olan dərgaha göndərdi. O zaman dinin pənahı olan şah özünün bacısı oğlu və Müzəffər sultanın nəvəsi olan Cəmşid xana qayğı göstərib ona təbil, ələm, qoşun və məiyyət verdi.

Şeir

“Təbil və ələmlə baş ucalığı verdi ona,
Elə etdi ki, onun cahan xalqına ehtiyacı olmasın.
Səltənət meyi tökdü onun camına,
Qalxdı uca göylərə onun adı.
Başı şərəfdən elə bir yerə ucaldı ki,

[2547] Baroda nəşri: “padşah”.

Uçan qartal oldu onun tacının lələyi".

Onu çoxlu qoşunlarla Gilana hakim göndərdilər. Xan Əhməd Kuçsəfandan[2548] savayı, bütün Biye-pəs vilayətini Cəmşid xana təslim etdi. Bu əsnada dinin pənahı olan şah, Yolqulu bəy Zülqədəri göndərdi ki, Kuçsəfanı ondan alıb Cəmşid xana versin. Xan Əhməd cəhaləti və dəliliyi səbəbindən alçaq adamların sözlərinə aldanıb Əmirə Şahmənsuru çoxlu qoşunlarla və divə bənzər gilanlılarla onu dəf etməyə yolladı. Onlar xəbərsizcə Yolqulu bəyə hücum çəkib xeyli döyüşdən sonra onu qətlə yetirdilər və bilmədilər ki, aslanın döşünü sağmaq və batil xəyal ilə ölümcül zəhər içmək öz həlakı üçün çalışmaq deməkdir.

Elə ki bu xəbər alicənab şaha çatdı, o həzrətin sinəsindən kin və intiqam atəşi şölələndi və mübarək çöhrəsində qəzəb əlaməti müşahidə olundu. Aləmin müti olduğu bir fərman verildi ki, Azərbaycan və İraq vilayətindən çoxlu piyadalar yaraqla ali taxtın ətəyinə yollansınlar və əmirlərlə birlikdə Gilana hərəkət edib o diyarı fəth etsinlər. Xan Əhməd qızılbaş qoşunlarının gəlişinin avazından vahiməyə düşüb, etdiklərindən peşman oldu və törətdiklərindən təəssüfləndi. O, aləmin pənahı olan dərgaha elçilər göndərib tüğyan tufanından xilas qayığında pənah axtardı. Ali taxtın ətəyinə gələn elçilər hərçənd o həzrətin (şahın) könlünü razı salmağa çalışsalar da, heç bir faydası olmadı. Çünki onun yalan və riyakarlığının surəti dinin pənahı olan şahın nurlu ürəyinə aydın olmuşdu və onun hiylə və məkrinin şüasını [şah] öz könül aynası ilə müşahidə edə bilmişdi. Ona görə də [şah] elçiləri murada və arzuya yetirmədən, onlara geri qayıtmaq üçün rüxsət verdi. [Şah tərəfindən] ali əmr verildi ki, qazilər iki istiqamətdən Gilana hərəkət etsinlər: Sultan Mustafa mirzə, Əmir xan Türkman, Qoç xəlifə Möhürdar, Nəzər bəy Ustaclu, Qum hakimi Vəli xəlifə Şamlu, Əmirqeyb bəy Ustaclu, Savə hakimi Heydər bəy Türkman, Əhməd xəlifə Vəfadar Şamlu, Həmzə bəy Talış, Azərbaycan əmirlərindən İbrahim bəy Ziyadoğlu, Qaracadağ hakimi Xəlifə Ənsar, İbrahim xəlifə Alpavut, İbrahim xan Zülqədərin oğlu Zeynal bəy, Kəsgər hakimi Əmirə Sasan, Əhməd sultan Biye-pəsi, Kutəm (Kuhdəm) hakimi Kamran mirzə Azərbaycan piyadaları ilə Kuçsəfan yolundan Lahicana getsinlər; Məsum bəy Səfəvi, İbrahim xəlifə Alpavutun oğlu Sədrəddin xan, Bayandur xan Talış və İbrahim bəy Qacar Müsahib isə Xalxal yolundan Lahicana yollansınlar.

Yüksək şanlı əmirlərin toplanmasından öncə Əmir xan Türkman, Nəzər bəy və Həmzə bəy Talış müzəffər qoşunlarla Qəzvin şəhərindən çıxıb şəhərin dörd fərsəxliyində dayandılar. Eşitdilər ki, Xan Əhməd sayı yağış qədər olan ordu ilə Deyləmanda məskən salmışdır. Adları çəkilən əmirlər qalibiyyətli əsgərlərlə o qəhr olmuş qövmün üzərinə sürətlə hərəkət (ilğar) etdilər. Xan Əhməd təfəkkür girdabına və heyrət burulğanına düşüb can qorxusundan özünü Lahicana saldı. Qazilər onun çadırını, saray pərdəsini və bargahını ələ keçirdilər, Deyləmana və Xərgama daxil oldular. Məsum bəy Səfəvi də qantökən ordu ilə hərəkət bayrağını Lahican tərəfə yüksəltdi. Xan Əhməd Lahican sipəhsaları Əmir Cahangirlə Deyləman və Ləştənəşa sipəhsaları Şahmənsuru on min süvari və piyada ilə [qızılbaşları] qarşılamağa göndərdi. Onlar yaxşı bir yerdə taxtabənd (taxta barrikada) qurub, döyüşə və vuruşa hazır oldular. Məsum bəy həddən və hüduddan artıq bir ordu taxtabəndə çatdı. Müxaliflər qılınc və nizə işlətməyərək fərar yolunu tutdular. Qazilər o bədbəxt qövmdən yüz əlli nəfəri qətlə yetirdilər, daha üç yüz əlli nəfəri əsir etdilər, Lahicanda məskən saldılar, Gilan, Guge, Ləştənəşa və Kisəm vilayətini ələ keçirdilər.

Xan Əhməd yağış ədədli və tufan mədədli ordunun hərəkətindən agah olduqda təfəkkür dərəsində və heyrət yolunda sərgərdan oldu. O, nəhs bəxtin və uğursuz taleyin nişanəsini müşahidə etdi. Bildi ki, müqavimət [göstərməyə] taqəti yoxdur və fərar atını altına çəkib Əşkur dağlarının yolunu tutdu. Göyərçin ovlamaq məqsədi ilə şığıyan qartal kimi düşmənin canına uçan oxu, sərçə kimi qutu yuvada[2549] pünhan oldu. Düşmən pusqusunda ağız açan kamanı, qorxusundan ox qabının içinə girdi. Döyüş günündə bayraq kimi başı uca və sabitqədəm olan nizəsi, başını qılafın dibinə soxdu. Düşmənin başına meyil edən qılıncı, həmayil kimi boynundan asılı qaldı. Düşmənin həmləsi[2550] qarşısında çəpər olan qalxanı, karvan torbası kimi çiyninə yükləndi. Sədrəddin xan, *Ziyaəddin*[2551] Əhməd sultan, Bayandur xan Talış, Əmirə Sasan, Həmzə bəy Talış və Mirzə

---

[2548] Kuçsəfan (Kuçesfəhan) – İranda Gilan vilayətinin Rəşt şəhristanının beş nahiyəsindən birini təşkil edir və mərkəzi Kuçesfəhan qəsəbəsidir. Kuçesfəhan qəsəbəsi Rəşt şəhərindən 15 km. qərbdə yerləşir.

[2549] Baroda nəşri: "bayquş yuvasında".

[2550] Məclis nüsxəsi: "düşmənin gürzü".

[2551] Nuruosmaniyyə nüsxəsi: "Ziya". Bakı nüsxəsi əsasında düzəliş edilmişdir.

Kamran bir dəstə bahadırla o dağın yollarında pərakəndə olan müxaliflərin üzərinə gedib, Əmirə Bahadırı neçə nəfər digər əmirlərlə birlikdə qətlə yetirərək müzəffər və qalib şəkildə Məsum bəyin ordusuna qayıtdılar. Bölük-bölük öndər məliklər və rəiyyətlər bulud topası və buxarlanan köpük kimi dağ başına və Əşkur cəngəlliyinə sığındılar. Belə ki, o məskənlərə daxil olmaq üçün yalnız bir yol var idi və lakin o da gözəllərin beli kimi dar (incə) idi.

Ali mənşəli əmirlər əğyarın məşəqqəti (düşmənin müqaviməti) olmadan Gilan məmləkətinin gəlinini ağuşa çəkdilər (Gilan məmləkətini ələ keçirdilər). Nəzər bəy Ustaclu, Əmirqeyb bəy Ustaclu, Qoç xəlifə Möhürdar, Pirə Məhəmməd xan Ustaclu, Əmiraslan bəy Əfşar və Heydər bəy Türkman döyüşkən süvarilərdən və tüfəng atan piyadalardan [ibarət] bir dəstə ilə Taliqan yolu ilə getdilər. O yol min işvəyə malik dolambac bir yol idi, [cənnətə aparan] doğru yoldan daha dar (incə) və cəhənnəmin yolundan daha qaranlıq bir yol idi. Onun lili, cəngəlliyi və darısqallığı o dərəcədə idi ki, bu darısqallıqda yoldan bir süvari çətinliklə keçə bilirdi. Əgər doğru yoldan başqa hər hansı tərəfə meyil etsəydilər, at və adam həlak olardı.

Şeir

“Aşiqin sevdası qədər uzun,
Fələyin dövrü kimi enişli-yoxuşlu bir yol.
Çətin keçidlər və çətin zirvələr,
Qranitin daş ürəyi onu gördükdə olar laxta-laxta.
Onun səmum küləyi qiyamət suru kimi təsir edər,
Havası əfi ilanın nəfəsi kimi zəhərlidir”.

[Qızılbaşlar həmin yoldan] keçdilər. Yol əsnasında Xan Əhmədin kürəkəni Məlik Üveys Rüstəmdarini tutub, adı çəkilən şəxsin qardaşı olan Məlik Sultan Əbu-Səidə [təhvil] verdilər. Məlik Üveysin qalalardakı bütün mallarını və əşyalarını xasseyi-şərifə üçün zəbt etdilər və Tonəkabonda[2552] dayandılar.

Təxminən iyirmi min ailədən ibarət Deyləman, Guge, Kisəm və Xərgam camaatı və hərbçiləri yetərincə hündür və möhkəm bir neçə zirvəsi olan Babakuha (Baba dağına) pənah apardılar. Axırda ərzaqları tükəndiyi üçün Əhməd xanın yanına adam göndərdilər və azuqə istədilər. Xan Əhməd çoxlu azuqə toplayıb onların arasına gəldi.

Bu xəbər Məsum bəyə çatdıqda, Sədrəddin xanla Əhməd sultanı düşərgədə qoyub, Bayandur xan Talışı, Kəsgər hakimi Əmirə Sasanı, Həmzə xəlifə Talışı və Kuhdəm[2553] hakimi Mirzə Kamranı çoxlu ordu ilə yaramaz düşmənlərin üzərinə göndərdi. Onlar müxaliflərin üstünə getdilər. Dünyanın aqat daşının (qaranlığın) cahangir günəşin basqınından aram tapdığı zülmətli bir gecədə onlar Xan Əhmədin başının üstünü aldılar. Şahmənsurun əmisi Əmirə Bahadırı əmirlərdən iki nəfərlə birlikdə qətlə yetirdilər. Xan Əhməd min hiylə və məkrlə özünü o bəla burulğanından [çıxarıb] Əşkur dağına saldı. Dərədə və sığnaqda olan adamlar aman dilədilər. Əmirlər onları götürüb Məsum bəyin yanına gəldilər.

Hər halda, Xan Əhməd həqiqətən bildi ki, üz döndərmiş bəxti və üzülmüş ürəyi onu qara torpağa oturtmuşdur və belə olan təqdirdə bundan sonra qızılbaş qoşunları ilə qarşıdurmaya, vuruşmağa və müqavimət göstərməyə qüvvəsi qalmamışdır. Onun sığınacaq tapdığı bir neçə yerin hamısı istehkamlı dağlar və möhkəm məkanlar olsalar da, amma onun dövlətinin və bəxtinin təməlinə düşmüş sarsıntını aradan qaldırmaq mümkün deyildi. O deyirdi:

Nəzm

“Niyyətimin mənzili ürək çəkən və uca olsa da,
Öz bəxtim ki möhkəm deyil, nə fayda?!”

Xan Əhməd təqribən üç ay Gilan dağlarında heyran və sərgərdan olub, hərəkət etdiyi hər səmtdə özünü bənd və bəla əsiri, zəhmət və yorğunluq xəstəsi olaraq gördü. Bu əsnada dinin pənahı olan şah Allahqulu Ayçəkoğlunu, Şahqulu bəy Rumlunu və Mirzə Əli bəy Qacarı yaxşı silahlanmış səkkiz yüz nəfər qorçu ilə Əşkur yolundan Gilan tərəfə göndərmişdi. O vaxt aləmi işıqlandıran günəş Oğlaq bürcünün üçüncü dərə-

[2552] Tonəkabon – İranın Mazandaran vilayətinin qərb hissəsində, Mazandaranın Gilanla həmsərhəd olan zonasında yerləşən tarixi mahal. Mazandaran ostanının indiki Şahsavar şəhristanının bütün ərazisi əvvəllər Tonəkabon adlanırdı. Hal-hazırda isə Tonəkabon Şahsavar şəhristanının nahiyələrindən biridir.

[2553] Kuhdəm – Gilanda, Rəştlə Lahican arasında, Qızılüzən (Səfidrud) çayı kənarında yerləşən bölgə.

cəsinə çatmışdı. Soyuğun şiddəti və havanın şaxtasının çoxluğu o həddə yetmişdi ki, böyük dağlar bütövlüklə hamar olmuş, bulud sincab kürkünü çiyninə salmış və yerin səthi qardan qaqum[2554] [dərisi] geymişdi (ağappaq olmuşdu).

Beyt

"Dağ qaqum [rəngində] idi, yer vağ geyiminə bürünmüşdü,
Çərxi-fələk sincab [kürkü] çəkmiş çiyninə.
Gecə əsən külək bir naqqaş kimi,
Dalğa-dalğa suyu qıvırıb, burub".

O uzaq və uzun vadi enişlə və yoxuşla dolu idi. Onun zəminindəki ölçüsüz və dəhşətli cəngəlliklər və hədsiz meşələr, görməyən göz kimi, nə gündüz günəşin nurundan bir ləhzəyə malik idi, nə də [gecə] ayın şüasını qəbul edirdi.

Şeir

"Könül gözündən savayı, kimsə görməyib zirvəsini,
Güman ayağından savayı, kimsə enməyib dibinə.
Divin qorxusundan hamının ürəyi əridi,
Sərt küləkdən hamının ruhu dondu.
Meşə-meşə qalaqlanıb orada çör-çöp yığını,
Divar-divar ucalıbdır orada xalis qum.
Mağaralarının içindəki həşərat gürzə ilandır,
Çeşmələrindəki heyvan yırtıcı aslandır.
Rahatıq tapmaq üçün onun zirvələrinə gedib Hümay,
Çünki orada müsafirlərin sümüklərindən azuqəsi boldur".

Bayram bəy Qaramanlunun oğlu Hüsam bəy işə yarayan cavanlardan on səkkiz nəfərlə səhərə yaxın xəbərsiz şəkildə xanın üstünə gəldi. O, can qorxusundan bir tövlədə gizləndi. Çoxlu axtarışdan sonra onu tutub Allahqulu sultanın yanına apardılar. Gilan[2555] fəthinə təyin edilmiş böyük əmirlər Xan Əhmədi mallar və əşyalar, dəfinələr və xənizələrlə seşənbə günü, rəcəb ayının 6-da (06.01.1568) aləmin pənahı olan dərgaha gətirdilər[2556]. Dinin pənahı olan şah neçə aydan sonra onu Qəhqəhə qalasına yolladı və Gilan vilayətinin idarəsini Allahqulu sultan Ustacluya, İsgəndər bəy Əfşara, Həmzə bəy Talışa, Zeynal bəy Zülqədərə və Şərəf xan Kürdə həvalə etdi. Qəzvində məhbus olan Mövlana Əbdürrəzzaq Sədr Xərsək qalasına göndərildi[2557].

Xan Əhmədin səltənət müddəti otuz iki il idi. Bu təbəqədən on bir nəfər bu ardıcıllıqla səltənət sürmüşdür: Seyid Əli Kiya Karkiya, Rza Kiya Karkiya, Mir Seyid Məhəmməd Karkiya, Nasir Kiya Karkiya, Sultan Məhəmməd Karkiya, Mirzə Əli Karkiya, Sultan Həsən Karkiya, Sultan Əhməd Karkiya, Seyid Əli Karkiya, Sultan Həsən Karkiya, Xan Əhməd Kərkiya[2558]. Onların səltənətlərinin müddəti iki yüz beş ildir.

### Müxtəlif əhvalatlar

Həmçinin bu il dinin pənahı olan şah Şahqulu sultan Ustaclunu töhfələrlə, hədiyyələrlə və dörddə üç hissəsi sədaqət və dostluq haqqında, cülusun və vilayətin fəth edilməsinin təbriki barəsində olan yetmiş gəz

---

[2554] Qaqum – çox qiymətli ağ xəzi olan və şimalda yaşayan heyvan; sincabın bir növü.

[2555] Baroda nəşri: "Lahican".

[2556] Nuruosmaniyyə nüsxəsində bir haşiyə qeydi var: "Mətndə yazıldığı kimi, şah Xan Əhmədi ələ keçirdi. Sultan Mustafa mirzə, Məsum bəy və Gilanın fəthinə təyin edilmiş başqa böyük əmirlər Lahican şəhərində idilər. Allahqulu sultan Ayçək[oğlu] onu (Xan Əhmədi) şahzadənin yanına aparıb təslim etdi və özü Lahicana hakim təyin edildi. Xan Əhmədi aləmin pənahı olan dərgaha gətirdilər".

[2557] Məclis nüsxəsində belədir: "Böyük qorçular çoxlu araşdırmadan və saysız axtarışdan sonra onu ... mövqeyində tutdular və aləmin pənahı olan dərgaha gətirdilər. O həzrət onu bir müddət sonra Qəhqəhə qalasına göndərdi. Onun yanında sədr olan Mövlana Əbdürrəzzaq isə Qəzvində idi. Bir müddət sonra onu sandığa qoyub Xərsəkə apardılar". Xərsək – Xoy civarındadır *(Seddon, II, 287).*

[2558] "Əhsənüt-təvarix"in Tehran çapında Biye-piş Gilanının hakimlərinin sülaləsi yanlış təqdim olunmuşdur. Belə ki, burada on bir hakimdən bəhs edilsə də, bəzi şəxslərin adlarının təkrar yazılması nəticəsində siyahıdakı hakimlərin sayı on yeddiyə yüksəlmişdir. Tərcümə zamanı şəcərə Baroda nəşri və Bakı nüsxəsi (256a) əsasında təqdim edilmişdir. Həmin xanədandan çıxmış on bir hakimin ardıcıllığını İsgəndər bəy Münşi aşağıdakı şəkildə sıralamışdır: Seyid Əli Kiya, Rza Kiya, Mehdi Kiya, Mir Seyid Məhəmməd, Nasir Kiya, Karkiya Sultan Məhəmməd, Karkiya Əli, Sultan Həsən, Xan Əhməd Mazi, Sultan Həsən, Xan Əhməd *(Tarixi-aləmarayi-Abbasi, I c., s.245).*

uzunluğunda bəlağət üslublu məktubla birlikdə Ruma göndərdi. Şahqulu sultan bir dəstə mülazimlə, tamam yaraqla, dəstə və məiyyətlə, təbil və ələmlə yola düşdü. O, Ədirnə şəhərində Sultan Səlimlə görüşdü, töhfələri təqdim etdi və neçə aydan sonra aləmin pənahı olan dərgaha gəldi.

## 976-CI İLDƏ (26.06.1568 – 15.06.1569) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Dinin pənahı olan şahın Gürcüstana qoşun göndərməsi və Simaun bəyin dustaq edilməsi

Gürcüstan valisi Simaun[2559] doğru yöndən ayağını və düzgün yoldan qədəmini kənara çıxarmış və əlini məmləkətlərin sərhədinə və yollara uzatmışdı. O, Tiflis şəhərinə də həmlə etdi. Tiflis elə bir şəhərdir ki,

Beyt

“Bostanında həmişə gül var,
Torpağı lalə və sünbüllə doludur”.

Onun havası mülayim və xoşdur, çəməni ürək oxşayır.

Beyt

“Heç bir təşviş onda yoxdu, dostun zülfündən savayı,
Heç bir bimarlıq onda yatmamış, yarın gözündən savayı”.

Onun çöllərindən səba və şimal yeli əsir. Yaz fəslində dağlarının başlarında və evlərində lalə, zahidlərin məbədlərindəki və kilsələrindəki əqiq qəndillər kimi uzaqdan parlayır.

Beyt

“Parlaq lalə orada çıraq kimidir,
Lakin onun dərdindən[2560] canına dağ çəkilib”.

Onun qanovlarının və çeşmələrinin suları Kövsər və Zəmzəm suyu[2561] kimi lətifdir və yaxşı həzm edilir.

Beyt

“Onu küləyi İsa nəfəsi kimi can verən və ruh bəxş edən,
Onun suyu Kövsər suyu kimi qəm təmizləyən və səfalıdır”.

[Simaun belə bir şəhərdə] çoxlu dağıntı törədib o diyarın əhalisini kiçikli-böyüklü məşəqqətlə paymal etdi. Ona görə də [Şah Təhmasib tərəfindən] aləmin müti olduğu fərman verildi ki, Şamxal bəy Çərkəz, İbrahim xəlifə Alpavut və Əliqulu bəy Qacar, Davud bəylə ittifaqda Gürcüstana yollansınlar və Simaun bəyi tutub aləmin pənahı olan dərgaha göndərsinlər.

Yüksək şanlı əmirlər ucsuz-bucaqsız qoşunlar və saysız-hesabsız ordu ilə Gürcüstana doğru hərəkət bayrağını ucaltdılar. Məsafələri qət etdikdən sonra o vilayətə çatdılar. Simaun bəy doğru üsul seçərək və ehtiyatkarlıq yoluna riayət edərək elə bir dağa sığındı ki, yüksəklikdə göy səma ilə baş-başa olmaq iddiası edirdi, mətanətdə Dəmavənd dağı ilə bərabərlikdən dəm vururdu. Onun beli Məntəqətül-büruc səthi ilə eyni səviyyədə idi və onun bulağı günəş çeşməsindən daha yüksək idi. Hündürlüyü o boyda idi ki, bir nəzərin xətti onun zirvəsinə çatana qədər neçə yerdə fasilə verərdi və düşüncə gözətçisi xəyal nərdivanından savayı heç nə ilə onun qayasının başına ayaq qoya bilməzdi.

Nəzm

“Qoymuş onun ayağının qarşısına bulud alnını,
Çəkmiş uca göyün üstünə qılınc.
Fələk əlini Cövza bürcündən onun ətəyinə uzatsa da,
Lakin ona çata bilməmiş.
İti qılıncı ilə hər səhər çağı,
Yırtır dikbaş göyü dağın zirvəsi.
Canan həsrəti çəkən aşiqlərin yaş axıtdığı kimi,
Rəvandır onun çeşmələrindən sellər ətəyə doğru.

---

2559 Bakı nüsxəsi: “Simayun”.
2560 Yəni Simaunun vurduğu dərddən.
2561 Zəmzəm – Məkkədəki Kəbə evinin həyətində yerləşən quyu.

Gəzib-dolaşır onun aşağısında qabanlar,
Yuxarısında pələnglər vurnuxurlar.
Əyandır meşələrində yırtıcı aslan,
Nihandır mağaralarında gürzə ilan.
Bir tərəfində nərə çəkir divlər,
Digər tərəfində qulyabanılar ulayır".

Əzəmətli qazilər qaçılmaz qəzavü-qədər kimi o möhkəm dağa yollandılar. Gavurlar da döyüşə və vuruşa başladılar. Qazilər ox və kamana əl ataraq savaş atəşini alışdırdılar. Tez qanad çalan ox quşları sanki susuzluqdan ağız açmış kimi düşmənlərin gözlərinin çeşməsindən başqa su içmədilər və kaman qarğaları sanki guşələrdə belə bir fürsətin intizarında imiş kimi gavurların murdar cəsədlərindən savayı yuvaya yemək aparmadılar.

Beyt

"Qarğalar kaman qarğalarının avazından,
Sümüklərə qonaq olmağa tələsdilər".

O əsnada Simaun qürurunun çoxluğu ucbatından məhdud bir dəstə ilə qabiliyyətli orduya həmlə edib qazilərdən birini qətlə yetirdi. Amma bir igid onu izzət atından zillət torpağına salıb əsir aldı. Gavurlar qaçış yolunu tutdular. Onun ətrafındakı məiyyət əhlindən, nökərlərdən və xidmətçilərdən bəziləri öldürüldü və bəziləri əsir tutulub qılınca və oxa yem oldular. İlahi yardımın uğuru və [Tanrının] sonsuz köməyinin gözəlliyi ilə zülmün zülmət tozu ruzigarın səhifəsindən "Allahın [qüdrət] əli onların əlinin üstündədir"[2562] [ayəsində deyildiyi kimi] qüdrət əli ilə ən yaxşı tərzdə silindi və zəlalət küdurətinin pası canlıların qəlblərinin aynasından "Allahdan kömək"[2563] qayğısının sığalı ilə ən qəşəng şəkildə təmizləndi. Yüksək şanlı əmirlər Gürcüstan qəzavatından qayıdıb Simaun bəyi uca dərgaha göndərdilər.

**Müxtəlif əhvalatlar**

Bu il dinin pənahı olan şahın vəkili Məsum bəy şərəfli Hərəmeynə yollandı. Yol əsnasında rumilər qəflətən onun üzərinə tökülüb onu qırx səkkiz nəfər mülazimləri və yoldaşları ilə birlikdə qətlə yetirdilər və söz yaydılar ki, bu işi ərəb quldurları (yolkəsənləri) törətmişlər. Sultan Səlim üzrxahlıq etmək üçün Əli ağa Çavuşbaşını aləmin pənahı olan dərgaha göndərdi. O həzrət (Şah Təhmasib) məhəbbətin kamalı üzündən ona hörmət-izzət göstərib Rum diyarına [geri] göndərdi[2564].

Həmçinin bu il bilikli və fəhmli mövlana, elmləri və hikmət fənlərini cəmləşdirən, şərəfli seyidlərdən olan Əmir Əbülfəth darülirşad Ərdəbildə qəflətən əbədi aləmə yollandı. Cənab Mövlana [Əmir Əbülfəth] Mövlana Üsaməddinin tələbələri cümləsindəndir və Mavəraünnəhrdə təhsil almışdı. Axırda adı çəkilən şəhərdə (Ərdəbildə) məskunlaşmışdı. Uğurlu qələminin məhsulu olan əsərlər sırasında bunlar vardır: "Haşiyə bər Kübra" ("Kübra əsərinə dair haşiyə"), "Haşiyə bər adabi-bəhs" ("Bəhs ədəb-ərkanına dair haşiyə"), "Haşiyə bər təhzibi-məntiq" (Məntiq təlimə dair haşiyə"), "Haşiyə bər kənzül-irfan" ("İrfan xəzinəsinə dair haşiyə"), "Haşiyə bər təhzibi-üsuli-fiqh" ("Fiqh üsulu təliminə dair haşiyə"), "Haşiyə bər bəhsi-məchulü mütləq" ("Məchul və mütləq bəhsinə dair haşiyə"), "Haşiyeyi-mətale" (Mətlələr haşiyəsi"), "Risalə dər üsuli-fiqh" ("Fiqh üsulu haqqında risalə"), ehkam ayətlərinə dair farsca "Şərhi-babi-hadi-əşər" ("On birinci fəslin şərhi").

---

[2562] *Qurani-kərim, "Fəth" surəsi, 10-cu ayə.*
[2563] *Qurani-kərim, "Səf" surəsi, 13-cü ayə.*
[2564] Nuruosmaniyyə nüsxəsində bəzi yerləri pozulmuş bir haşiyə qeydi var (pozulmuş yerləri cümlənin mənasına uyğun surətdə bərpa edib düzbucaqlı mötərizə daxilində yazdıq): "Məsum bəy islam həccini həyata keçirmək və insanların ən xeyirlisi olan həzrətin (Məhəmməd peyğəmbərin) nurlu məqbərəsini təvaf etmək niyyətinə düşdükdə, Şahqulu sultan Ustaclu ilə birlikdə Ruma elçiliyə getmiş adamların bəziləri ona dedilər ki, sizin Rum padşahının ölkəsinə getməyiniz məsləhət deyildir, çünki rumilər [sizə zərər vura bilərlər]. Onlar Məsum bəyin [həcc] ziyarətinə [yollanmasına] münasibət bildirərək ona "sizin getməyiniz məsləhət deyildir" söylədilər. Lakin vəkil vəzifəsinin sahibi (Məsum bəy) bu fikri qəbul etmədi. Buna baxmayaraq, Van ölkəsindən ta qətlə yetirildiyi vaxta (yerə) qədər onunla izzət və ehtiramla davrandılar və daim hörmət [göstərdilər]. Ulu Mədinədən üç mənzil məsafədə Xanmirzə adı ilə məşhur olan, tayı-bərabəri olmayan, əqli və nəqli elmləri [yaxşı bilən] oğlu Mirzə Xanəhmədlə, bir neçə nəfər mülazimi və etibar, ixtiyar sahibi olan Bəşarət bəy Daruğa ilə birlikdə qətlə [yetirildi]".

**977-Cİ İLDƏ (16.06.1569 – 04.06.1570) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT**

**Dinin pənahı olan şahın Cərun çöllərinə qoşun çəkməsi**

Bu il izzətli və cah-calallı [şahın] qulağına çatdı ki, Cərun çölləri ölkəsi oranın valilərinin zülmü ucbatından nizam-intizamını itirmiş, o məmləkətin sakinlərinin halına tamam pərişanlıq yol tapmış və oranın müsəlmanları azar və əziyyətdən zərər çəkmişdirlər. Ona görə də [şahın] aləmi bəzəyən düşüncəsi o camaatın ölkəsindəki [vəziyyəti] dəyişdirməyi qət etdi və qərara aldı. Kirman valisi Yaqub bəy Əfşarı çoxlu qoşunla o camaatın üzərinə göndərdi. Onlar (Cərun çöllərinin valiləri) öz əməllərinin yamanlığı və öz fəaliyyətlərinin qəbahəti ucbatından xoflu və vahiməli olub, Mina, Tərzək və Şümul qalalarına sığındılar. Havasının hərarətli olması səbəbindən o zamana qədər kama çatmış sultanlardan heç kəsin iqtidar əli oraya yetişməmişdi.

Şeir

“İstisi temmuzdakı (iyuldakı) qızmar hərarət kimi,
Soyuğu üzgüçülükdəki yaş rütubət kimi.
Oradakı qum atəş kimidir və onun tozu tüstü kimi,
Adamları quş kimidir, qarşıdan əsən küləyi kabab şişi kimi.
Onun mağaralarında tapmış Harut[2565] qərar,
Onun meşələrindən ifrit etmiş mütəkkə”.

Zəfər şüarlı qazilər o qalaları mərkəz kimi dövrəyə aldılar. [Qızılbaşlar] qalaları ələ keçirməyin ləvazimatını tərtib etməzdən öncə düşmənlər və rəqiblər qalibiyyətli qoşunun fəth bayrağını gördükləri üçün öz əhvallarının qismətinə zəiflik və qüsur düşəcəyini hiss etdilər və öz iş-güclərinin sonunda acizlik və süstlük əlamətləri sezdilər. Onlar çarəsizlik ətəyinə əl vurdular, müqavimət qalxanını atdılar, boyunlarına qılınc və kəfən asaraq yuxarıdan (qaladan) aşağıya gəldilər (endilər). Dünyanın pənahı olan dərgahın sərkərdələri[2566] o qalaları zəbt etdilər.

**Müxtəlif əhvalatlar**

Bu il Venedik padşahı kafirlər ordusunun bir dəstəsini Rum xondgarının ölkəsinə basqın etməyə göndərdi. Xersek (Hersoqavina) diyarının hakimi Qasım bəy, Fərhad bəylə birlikdə onları qarşılamağa tələsib o azğın məlunlarla və müşriklər güruhu ilə savaşdı. Bədkirdar kafirlər döyüşdən və vuruşdan sonra məğlub oldular. Rumilər onları təqib edib beş qadırğa, iyirmi qalyon və iki barcanı ələ keçirdilər. O əsnada adsız-sansız Firəng sərdarlarından Bahsene[2567] adlı dinsiz məlun, otuz min[2568] nəfər zəlalət ayinli kafirlə peyğəmbərlər ağasının (seyyidül-mürsəlin) dininin mücahidlərinə qarşı döyüşməyə gəldi. Rum ordusu onlara hücum edib, asimanı döyəcləyən top zərbəsi ilə onları məğlubiyyətə uğratdı.

Bu il Özbək sultan ibn Rüstəm sultan ibn Canibəy sultan çoxlu qoşunlarla Xorasan şəhərlərinə basqın etməyə gəlib Cam qəsəbəsində dayandı. O diyarın valisi Zeynal bəy İbrahim xan oğlu Zülqədər cövşən geyən bahadırlardan [ibarət] bir dəstəni onlarla savaşmağa göndərdi. Qazilər imkan qədərincə döyüşdülər. Amma Zeynal bəyin vəkili Həmzə bəy Səncəroğlu qətlə yetirildi. Özbəklər bol mallarla vətənlərinə qayıtdılar. Zeynal bəy Xorasan hakimlərinin yanına yaxşı nitq qabiliyyəti olan adamlar göndərib yardım istədi. O vaxt Əmir Hüseyn və Hacı sultan Kutval təxminən min doqquz yüz nəfərlik yaxşı silahlanmış süvari dəstəsi iləköməyə gəldilər. Zeynal bəy onların gəlişindən sonra arxayınlaşıb özbək sultanlarının ardınca sürətli yürüş etdi. Hərçənd Əmir Hüseyn və Hacı Kutval dedilər:

- Dövlətin faydası ondadır ki, bu yerdə qalıb öz diyarımızı mühafizə edək.

[Lakin] Zeynal bəy lovğalıq və qürur ucbatından dedi:

- Sizin ürəyinizi tamam qorxu bürümüşdür. Mən bəndə onları qolu bağlı gətirib gələcəyəm.

Ona görə də qazilər o nadan cahilin sözünə aldanıb yola düşdülər. Xatun körpüsündə alçaq özbəklərə çatdılar. Özbək sultan yeddi min cavanla pusquda durub məhdud bir dəstəni [Zeynal bəyin] qarşısına göndər-

---

[2565] Harut – dünyəvi bir qadına bəslədikləri sevgiyə görə cənnətdən qovulmuş iki mələkdən birinin adı (digərinin adı: Marut).
[2566] Məclis nüsxəsi: “şahın əsgərləri”.
[2567] Bakı nüsxəsi: “Bicetse”; Baroda nəşri: “Baçesne”; Məclis nüsxəsi: “Naceste”.
[2568] Baroda nəşri: “üç min”.

di. Qazilər onlara həmlə etdilər. Özbəklər yalandan qaçış yolunu tutdular. Özbək sultan qəflətən pusqu yerindən çıxıb qaziləri dövrəyə aldı. Döyüş və vuruşdan sonra yaramaz özbəklər ali mənşəli əmirlərə qalib gəldilər. Zeynal bəy və Əmir Hüseyn cəsarətli igidlərdən min nəfərlə birlikdə ölüm şərbətini içdilər.

Beyt

"Mərdliyə arxayın olmaq lazım deyil,
Çünki zəmanənin əli sənə də uzanacaq".

Hacı Kutval özünü coşqun dənizin təlatümündən nicat sahilinə çatdırdı. Özbək sultan öldürülənlərin başlarını bədəndən ayırıb Əndixud və Şibirğan tərəfə yollandı.

## 978-Cİ İLDƏ (05.06.1570 – 25.05.1571) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Sultan Səlimin Kıbrısa qoşun göndərməsi

Kıbrıs adasının kafirləri illərlə Rum padşahına bac versələr də, axırda dövlət qüvvətinin şərabı və hökumət qüdrətinin sərxoşluğu ucbatından onların beyni karıxdı, itaət boyunduruğundan başlarını çıxardılar, tabeçilik qibləsindən üzlərini döndərdilər, şəhərlərin yollarını kəsdilər və bəndələrə əziyyət verdilər. Həmin məsələ ilə əlaqədar Rum padşahı Sultan Səlim dövlət ərkanı və saray əyanları ilə məşvərət etdi. Əmirlər ağlabatan dəlillərlə o qalanın fəthini sultanın nəzərində asan etdilər. Ona görə də Sultan Səlim ikinci vəzir (vəziri-sani) Pərtöv paşanı, üçüncü vəzir (vəziri-salis) Əhməd paşanı, Rumeli əmirülümərası Hüseyn paşanı, Lələ Mustafa paşanı, Mərəş hakimi Əli paşanı, Anadolu hakimi Qasım paşanı və Sivas valisi Bəhram paşanı müqayisəyəgəlməz ordu ilə möhtəşəm qalaları fəth etməyə göndərdi. Paşalar qələbə nişanlı qoşunlarla, dağ kimi gəmilərlə hərəkət bayrağını Kıbrısa doğru yüksəltdilər. Oranın ətrafına çatdıqdan sonra həmin diyarın nahiyələrini fəth etməyə yollandılar. Təxminən yetmiş kiçik qala (hasarça) fəth olundu. O ərazinin fəthindən sonra böyük bir ordu ilə, qala fəth etmək üçün gərək olan ləvazimatla, saysız top-tüfənglə Lefkoşa[2569] qalasının ətrafına gəldilər. Firəng sərdarları top-tüfəng atmağa başladılar. Müzəffər əsgərlər o qalanı üzük qaşı kimi dövrəyə aldılar, top və badlic zərbəsi ilə qala bürclərini viran qoydular. Amma Firəng dilavərləri ad-san üçün bahadırcasına səylər göstərdilər və cəsurcasına həmlələr etdilər. Təqribən iki il bədbəxt kafirlər qalanı qorudular[2570]. Dövran mübarizləri döyüş meydanına yollandılar. Savaş dəstələri və ləpələri təlatümə gəldi. Rum ordusu top, tüfəng və zərbzən zərbəsi ilə hasarın bürclərini sarsıtdı və qəti hücumla hasarın bürcünün başına çıxdı. Kafirlərin ordusu iti qılıncın qorxusundan fərar yolunu tutdu. Rumilər onların arvad-uşaqlarını əsir etdilər. O qaniçən ordunun əlinə çoxlu qənimətlər düşdü. Paşalar o diyarı soyub qarət etdikdən sonra qəzəbli və kinli bir şəkildə böyük ordu ilə Mağusa (Maqosa)[2571] qalasına yollandılar. O elə bir qaladır ki, başını dövr edən fələyə çəkmiş və ruzigarın gözü onun mislini görməmişdir. İldırım salan buludun iqtidar əli onun pərdələrinə çatmır və onun uca bürclərinin zirvəsinin sakinlərinin azuqəsi Pərvin (Ülkər) [ulduzunun] sünbülündən və ay xırmanından [ibarət] idi. Qala hakimi Viten[2572] səbat ayağını yerə basıb, öz şövkət və qüvvətinə inamından dolayı qala qapılarını ayıq-sayıq adamlara tapşıraraq top-tüfəng atmağa başladı. Şimşək kimi çaxan tüfəng gülləri, aləmi yandıran neft tuluqları, gurultulu zərbzənlər və düşməni vuran toplar heç kəsə qalaya yaxınlaşmağa macal vermirdi. Amma buna baxmayaraq, Rum ordusu da o qalanın ətrafında möhkəm dayanmış və onu bir nöqtə kimi dövrəyə almışdı.

O zaman Venedik valisi şəhər hakimi üçün barıtla dolu və çox qüvvətli on səkkiz gəmi göndərdi. Qılıc Əli gəmiləri ələ keçirərək firəngləri qətlə yetirdi. Ağır qazğanların zərbəsi ilə o möhkəm qalanın bürclərini yıxdılar. Amma bunun bir faydası olmadı. Məlun kafirlər Anadolu qoşunlarının çadırları altından böyük lağım atdılar və onun içini barıtla doldurub od vurdular. Ona görə də bir sıra rumilər həlak torpağı üzərinə düşdülər.

---

[2569] Lefkoşa – Kiprin paytaxtı. Başqa bir adı: Nikosiya.
[2570] Əslində isə Lefkoşa yeddi həftə mühasirədə saxlanmış və 9 sentyabr 1570-ci ildə fəth edilmişdir *(J.V.Hammer. Osmanlı tarihi, II c., s.126-127)*.
[2571] Kiprin Famaqusta (Qazimağusa) şəhəri nəzəri tutulur.
[2572] Baroda nəşri: "Yatan". Əslində, həmin qalanın hakimi Marko Antonio Braqadino olmuşdur *(Seddon, şərhlər, s.289)*.

Mühasirə əyyamı bir il çəkdiyindən kafirlərin barıtı tükəndi. Viten öz əhvalı üzərində acizlik və çarəsizlik əlamətləri müşahidə edib yəqin bildi ki, Rum qoşununa müqavimət edə bilməyəcək. O, əhd-peyman etdikdən və [paşalara] "Quran"a and verdikdən sonra qalanı təslim edib paşaların dərgahına gəldi. Belə qərara alındı ki, o, öz mallarını və əşyalarını gəmiyə qoyub Venedikə yollansın. O əsnada Rum əsirlərindən biri fərar edib gəldi və məruzə etdi ki, məlun kafirlər son dərəcə hiddət və kin üzündən təxminən üç yüz nəfər müsəlmanı qətlə yetirmişlər. Ona görə də Mustafa paşanın qəzəb atəşi alovlandı, Vitenin dərisini üzüb, qalan kafirləri də qətlə yetirdi. O diyarın fəthindən sonra Sultan Səlim, Pərtöv paşanı və Əli paşanı tərtibə salınmış qoşunla və igidlik zinəti ilə bəzənmiş ordu ilə, təbil və kosla Korfusu fəth etməyə yolladı. Rumilər Korfus, Akta, Kefaliya və Krit adalarına[2573] basqın edib, firənglərdən dörd qadırğa və üç barca ələ keçirərək müzəffər və qalib şəkildə, qeyri-məhdud qənimətlərlə İstanbula qayıtdılar.

### Müxtəlif əhvalatlar[2574]

Bu il Rum padşahı Sultan Səlimin əmri ilə Tatar valisi Əsgəri xan[2575] Kəfə paşası ilə birgə çoxlu qoşunla və iki min beldarla Qurbanbaziyə[2576] gəldilər və nəhr (kanal) qazımağa başladılar ki, İtil (Volqa) çayını Tin (Don) çayına birləşdirsinlər və onu bitirdikdən sonra gəmiyə oturub, Hacıtərxana yollanaraq o şəhəri fəth etsinlər. Elə ki bu xəbər Rus padşahı Knyaz İvan[2577] tərəfindən o diyarın valisi olan şəxsə çatdı, iztiraba düşüb Əsgəri xana yaxşı töhfələr göndərdi. Hacıtərxanı tutmaq xanın ürəyincə deyildi. Çünki o qorxurdu ki, get-gedə bu iş ona da sirayət edər[2578]. Bu səbəbdən o, Sultan Səlimə bir ərizə göndərdi. Məzmunu belə idi: "Əgər İtil çayı Tin çayına birləşərsə, onun da suyu Qara dənizə axacaqdır. Belə olarsa, dənizin daşması qorxusu vardır və İstanbul tamamilə xaraba qala bilər". Ona görə də nəhr qazımaqdan əl çəkmək haqqında fərman verildi. Xan və paşa hər biri öz diyarına geri qayıtdı.

### 979-CU İLDƏ (26.05.1571 – 13.05.1572) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Rum padşahı Sultan Səlim Sinan paşanı Misir qoşunları, dərgah yeniçəriləri və yüksək məqamlı əmirlərlə Yəmən vilayətini fəth etməyə göndərdi. Ona görə ki, Sultan Süleymanın[2579] ölümündən sonra Mütəhhər Ləng o vilayəti ələ keçirmişdi. Adı çəkilən paşa qalibiyyətli əsgərlərlə o diyara gəldi. Çoxlu döyüşdən sonra Kövkəban qalasını ələ keçirib təxminən qırx qalaçanı fəth etdi.

Həmçinin bu il Sultan Səlimin əmri ilə Kəfə vilayətinin valisi Dövlət Gəray xan Tatar hərəkət bayrağını Rus tərəfə qaldırdı. O diyarın valisi Uluğ bəy (Böyük knyaz İvan Qroznı) zəfər şüarlı qoşunların hərəkətindən xəbərdar oldu. O, öz əmirülümərası olan İvan [Be]mskeni[2580] əxlaqsız kafirlərdən [ibarət] bir dəstə ilə onların qarşısına göndərdi. Onlar Qlomola çayının[2581] kənarında mövqe tutdular və tatar qoşununun keçişinə mane oldular. On doqquz gün müddətində dilavərlər arasında bu minvalla döyüş və vuruş, hərb və savaş baş verdi. İyirminci gün Dövlət Gəray xan ildırım və külək kimi hərəkətə gəlib mərdanə səy göstərdi. Onlar (ruslar) vuruşdan və döyüşdən sonra fərar yolunu tutdular. Elə ki tatar qoşununun qələbəsi xəbəri yaramaz Uluğ bəyə çatdı, alaçıq və çadırını atıb məyusluq və pərişanlıq içində can qorxusundan fərar etdi. Tatar ordusunun

---

[2573] Korfus (Korfu), Akta (İtaka), Kefaliya (Kefaliniya) – İoniya dənizindəki 7 yunan adası sırasına daxildirlər. Krit – Aralıq dənizi ilə Egey dənizi arasında Yunanıstanın ən böyük adasıdır.

[2574] Məclis nüsxəsi: "Sultan Səlimin əmri ilə İtil çayını Tin çayına birləşdirmək üçün nəhr (kanal) qazılması".

[2575] Bakı nüsxəsində Əsgəri xanın adı çəkilməmiş və onun yerinə "tatar xanı" yazılmışdır.

[2576] Məclis nüsxəsi: "Fərmanyari".

[2577] İvan Qroznı nəzərdə tutulur. O, 1530-cu ildə doğulmuş, 1533-cü ildən Böyük Moskva knyazı, 1547-ci ildən ilk rus çarı olmuş, 1584-cü ildə vəfat etmişdir.

[2578] Burada Tatar valisi adı altında Krım xanı nəzərdə tutulmuşdur. Lakin həmin vaxt Krım xanı Əsgəri xan deyil, Dövlət Gəray xan idi. Osmanlıdan asılı olan bu yarımmüstəqil xan kanalın fəaliyyətə başlaması ilə Osmanlı qarşısındakı məhkumiyyətinin daha da artacağından qorxurdu. Bu səbəbdən o, Kəfə sancaqbəyisi dəftərdar Çərkəz Qasım bəyin kanalla bağlı təşəbbüslərinə hər vəchlə mane olmuşdur *(J.V.Hammer. Osmanlı tarihi, II c., s.114)*.

[2579] Tehran çapında səhvən "Sultan Səlim" yazılmışdır.

[2580] Rus ordusunun əmirülümərası İvan Meske və ya bir qədər sonra qeyd edildiyi kimi Bemeske adı altında rus ordusunun baş voyevodası (baş sərkərdəsi) knyaz İvan Belski nəzərdə tutulmuşdur (bax: *Н.М.Карамзин. История государства российского. Том IX. Санкт-Петербург, 1821, с.181-183*). Bakı nüsxəsində İvan Belke, Məclis nüsxəsində İvan Beske, Baroda nəşrində İvan Bemke yazılmışdır.

[2581] Bu hadisə indiki Orlov vilayəti ərazisində, Oka çayı kənarındakı Kroma qəsəbəsi yaxınlığında baş vermişdir.

hamısı birdən Moskav (Moskva) şəhərinə tökülüşdülər. Həmin şəhərin əhalisini qoca və cavan, qüvvətli və aciz, böyük və uşaq, qadın və kişi [daxil olmaqla] əsir aldılar. Kafirlərin illər uzunu yığdıqları inci, cövhər, qızıl və zivər yoxluq küləyinə verildi. Tatar qoşunu o şəhərə od vurdu. O bəd etiqadlıların evləri taxtadan olduğu üçün tamamilə yandı. Bemske təxminən iki yüz min nəfər bədbəxt kafirlə birlikdə cəhənnəm atəşindən öncə dünya atəşində yandı. Dövlət Gəray xan belə bir fəthdən sonra müzəffər və qalib şəkildə, qeyri-məhdud qənimətlərlə, o cümlədən doxsan min əsirlə öz diyarına qayıtdı.

**Ustaclu və qəriblü qorçularının giləklərlə müharibə etməsi haqqında söhbət**

Dinin pənahı olan şah Gilan hakimliyini Allahqulu sultan[2582] Ayçəkoğlu Ustacluya həvalə etmişdi. O da məhdud bir dəstəni Lahicanda qoyub özü yaylağa yollandı. Gilan sipahiləri müxaliflik etməyə başlayıb Seyid Hüseyn adlı birisini özlərinə hakim etdilər. O, Dibacı sipəhsalar [təyin] etdi. Özü isə çoxlu qoşununa, saysız dəstələrinə və [hərbi] birliklərinə arxayın olub xəyanət və məkr pusqusunda oturdu, cəfa əlini açdı, fitnə və şər alovunu alışdırdı. Onun könül sahəsində qiyam və inad kökü möhkəmləndi və sinəsində zülm fidanı qol-budaq açdı. O, çoxlu qoşunla və divə bənzər gilanlılarla Lahican qalasındakı sufilərin üstünə gəldi. Dava-qırğından sonra [qiyamçılar] onlara qalib gələrək onların [arasında olan] qadınları, kişiləri və uşaqları qətlə yetirdilər. Daha sonra onlar, haqqında bəhs etdiyimiz Allahqulu bəyin oğlu Bəktaş bəyin üzərinə həmlə etdilər. O, döyüşməyərək qaçdı. Giləklər onları qılıncdan keçirib gedər-gəlməzə göndərdilər. O zaman həmin bədbəxt qövmü dəf etmək üçün Əmirə Sasan çoxlu ordu ilə Kəsgərdən gəldi. Xeyli dava-qırğından sonra o, məğlub oldu. Giləklər onun əksər mülazimlərini qətlə yetirdilər. Özü isə çoxlu məşəqqətlə coşqun dənizin təlatümündən nicat sahilinə çatdı. Dinin pənahı olan şah bu barədə say-seçmə adamlar və müqərrəblərlə məşvərət etdi. Belə qərara alındı ki, onları dəf etmək üçün bir neçə əmir göndərilsin. O həzrət (şah) Qoç xəlifə Möhürdarı və Əmirqeyb bəyi digər sərdarlarla birlikdə müxalifləri dəf etməyə göndərdi. Ustaclu və qəriblü qorçularını da onlara yoldaş etdilər. O zaman qorçular arasında bahadırlıqdan söz düşdü. Onların arasından yüz otuz nəfər, əmirlərin izni olmadan Gilana yollanıb Kisəmə çatdılar. Qazilərin azlığından xəbərdar olan giləklər bir-birinə dedilər:

- Fürsəti qənimət bilmək gərəkdir və bir iş görmək lazımdır. Əgər biz özümüzü onlara daha tez çatdırsaq, əksəriyyətini əsir edəcəyik və bizim şücaət və igidliyimizin nişanəsi ruzigarın səhifəsi üzərində qalacaqdır.

Onlar bu batil xəyalla qazilərin üzərinə yollandılar. Qorçular təvəkkül əlini Pərvərdigarın qayğıkeşlik ətəyində möhkəm saxladılar və "Neçə dəfə olub ki, az bir dəstə Allahın izni (iradəsi) ilə çox bir dəstəyə qalib gəlib!"[2583] ayəsinin məzmununu yada salıb, Əxzər dənizi kimi coşub gurlayaraq düşmənlərin üzərinə üz qoydular. Gilan qoşunları dəstə-dəstə bir-birinin ardınca yetişib həmlə etdilər. [Lakin onlar] ox atmaqla məşğul olan qızılbaş ordusunu yerindən dəbərdə bilmədilər. O mərəkədə qan arxı axırdı. Mübarizlərin başları top kimi diyirlənirdi.

Şeir

"Çalaya yetərincə qan doldu,
Qırmızı kükürd kimi atəşin oldu torpaq.
Bir bədən yüz yerə parçalandı,
Qurdun və tülkünün yemi bol oldu".

Qazilər şimşək kimi çaxan tüfəngin zərbəsi ilə qaragün giləkləri həlak torpağına saldılar. Ürək deşən oxun və atəş saçan güllənin gəliş-gedişi vaxtı bədbəxt Dibaca bir tüfəng [gülləsi] dəydi. O, izzət yəhərindən zillət torpağına düşdü. Qorçular cəsarətlənib, hamısı birdən idbar əhlinə həmlə edərək onları amansız qılıncla vurdular. Parlaq qılınc tozanaq zülmətində çıraq kimi parlayırdı və tüstü tozunda atəş şüası kimi işıldayırdı.

Beyt

"Qılınc parlayır tozanağın tutqunluğunda,
Lacivərd pərdə arxasındakı atəş kimi".

---

[2582] Bakı və Məclis nüsxələri: "bəy".
[2583] *Qurani-Kərim, "Bəqərə" surəsi, 249-cu ayə.*

Zəmanə dikbaşının başı və əsr boynuyoğununun boynu bədənindən ayrılırdı.

Nəzm

“İpək kimidir və dəmiri ipək kimi edir,
Kəvər rəngindədir və bədəni kəvər kimi doğrayır.
Cövhəri peydadır günəşdəki zərrə kimi,
Peykəri parlaqdır səmadakı günəş kimi”.

Axırda qorçular gündən-günə tərəqqi edən dövlətin gücü ilə düşmənləri zəlil və zəbun edərək o bədbəxt qövmdən təxminən min nəfəri qətlə yetirdilər. Sayı iyirmi mindən artıq olan düşmən qoşunu az adam qarşısından fərar etdi. Müzəffər və qalib qazilər qeyri-məhdud qənimətlərlə Lahicana cah-calalla daxil olub onların başlarını aləmin pənahı olan dərgaha göndərdilər.

## 980-Cİ İLDƏ (14.05.1572 – 02.05.1573) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Rum padşahı Sultan Səlim, Pərtöv paşanı və Əli paşanı çoxlu gəmilərlə, saysız top-tüfənglə, təbil və kosla Korfus adasını fəth etməyə göndərdi. Onlar təxminən üç yüz gəmi ilə həmin qalaya yollandılar və o vilayətin ətrafına basqın edib istila bayrağını yüksəltdilər. O diyarı qarət etdikdən sonra yağış damlalarından artıq sayda ordu ilə Kritə yollandılar. O diyarı xaraba qoyduqdan sonra İncil adasında lövbər saldılar. O tərəfdən Venedik valisi ilə kafir sultanlar və əxlaqsız hakimlər cümləsindən olan, vilayətinin genişliyi və ordusunun çoxluğu baxımından tamam imtiyaz sahibi olan İsfaniyyə (İspaniya) hakimi Vari Felipi Şedye[2584], Dan Covanı[2585] yüz səksən qadırğa, altı mavna, min top və badliclə rumilərə qarşı döyüşə göndərdi. [Dan Covanın gəmilərindəki] hər qazğanının ağzının dairəsində elə bir top təsəvvür et ki, üfüqün əzəmətli dairəsi əndazəsindədir və yer kürəsini mərmi daşı yerinə ağzında saxlayar və ya sanki sübhün geniş dan yeridir ki, günəşin mancanaq daşını məşğrib quyusunun içindən çərxi-fələyin dolabına çıxarar. O gəmilərə elə topçular minmişdilər və top atmaqda elə mahir idilər ki, bir mil məsafədə dəniz üzərindəki köpük böyüklüyündə görünən gəmini qazğan daşı ilə vurardılar və Elburz dağını badlic zərbəsi ilə parça-parça edərdilər. Onlar İncil adası yaxınlığında lövbər saldılar. Pərtöv paşa və Əli paşa bir neçə gün o adada qaldıqdan sonra Qara Xocanı bir neçə qadırğa ilə qaravulluğa göndərdilər ki, yeddi ulduzun və doqquz göyün gərdişindən istər xeyir, istərsə şər, istər uğurlu, istərsə uğursuz bir hadisə baş verərsə, xəbər versin.

Qara Xoca uzaqdan Venedik ordusunun gəmilərini gördü, lakin İsfaniyyə qoşunlarının onlara yoldaş olduğunu anlamadı. O qayıdıb paşaya ərz etdi:

- Yaxşısı budur ki, onlara hücum etməyək. Çünki ləvəndlər (matroslar) öz vətənlərinə getmişlər. Döyüş yarağımız və top-tüfəngimiz azalmışdır. Bizim gəmilərimiz firənglərin mavnalarının yanında üfüq dairəsi qarşısında hilal qayığı kimidir və onların gəmisi böyüklükdə fələk simalıdır və sürətdə ilğım kimidir. O bədbəxt qövmün hər gəmisində o qədər top və tüfəng mərmisi, top daşı və zərbzəng gülləsi mövcuddur ki, onlar bu sursatlarla müqayisədə planetlərin, ulduzların sayının çox az olduğunu hesab edirlər. Firəng qövmünün gəmilərinə qarşı heç kimsənin müqavimət qüvvəti, qarşıdurma və vuruşma taqəti ola bilməz və o tayfa ilə gəmilərdə top-tüfənglə mübarizə etmək olmaz. Dənizçilik işində sanki dəniz xərçəngi kimi bütün bədənləri əldir, ayaqdır, dırnaqdır və çəngdir. [Su] üzündən düşməni aşağı aparmaqda (batırmaqda) başdan-başa hamısı köpək balığıdırlar. Mancanaq və top sənətində olduqca məharətli və bacarıqlıdırlar. Ölkələrə səyahət etməkdə və dənizləri üzüb keçməkdə cəld və çevikdirlər.

Əli paşa [onun sözlərini] qəbul etməyib dedi:

Şeir

“Ey Rüstəmə bənzəyən erkək aslanlar,
Əndişə etməyin döyüşdən.
Nə üçün ayaq çəkək vuruş yolundan geriyə?!
Gecə yatmaz cüyür kimsənin evində”.

---

[2584] Bakı nüsxəsi: “Dari Qelbi Şuye”; Baroda nəşri: “Vari Feli”; Bodleian nüsxəsi: “Vari Qeli”; Məclis nüsxəsi: “Dari Fili Beyn Şerdiye”. İspaniya kralı II Filipp nəzərdə tutulur *(Nəvai, şərhlər, s.1477).*

[2585] V Karlın qeyri-qanuni oğlu Don Juan (yenə orada).

Rumilər onun sözünü razılıq qulağı ilə dinləyib bəla girdabına və fəna dənizinin dibinə düşdülər. Gəmiləri hərəkətə gətirib düşmənlərə doğru yola düşdülər. İlk öncə Əli paşa firənglərə həmlə etdi. Dan Cavan dağ ərkanlı gəmilərlə rumilərin arxasından gəlib döyüşə və vuruşa başladı. Yaz buludlarından yağış damlaları yağdığı kimi, hər iki tərəfdən qazğan, firəngi və tüfəng mərmiləri yağırdı.

Nəzm

"Elə ki top mərmisi cahan gəmisindən açıldı,
Minlərlə dağ dənizdə hərəkətə gəldi.
Qandan tüfəng oldu hərb məclisinin saqisi,
Onun qolunda var idi Firəng noğulu".

İri həcmli və hamar qazğanların atəşindən və şimşək əməlli topların sədasından "Dənizlər od tutub yanacağı zaman"a[2586] uyğun vəziyyət meydana gəldi. Cürbəcür zərbzənlərin və topların buxarlarının yüksəyə qalxmasından buqələmun fələyin altında nilgün dəniz peyda oldu.

Beyt

"Tüfəng tüstüsündən o döyüş meydanında,
Təzə ay gözəllərin qaşları kimi qara oldu".

Müşriklərin sərdarları və məlun kafirlərin dilavərləri ağır topların zərbələri ilə rumilərin gəmilərini parça-parça etdilər. Savaş əsnasında Əli paşanın gəmisində məhbus olan bir sıra dinsiz firənglər xilas olub, Əli paşanın başını bədənindən ayıraraq nizənin ucuna taxdılar. Ona görə də Rum ordusu qaçış yolunu tutdu. Firənglər Pərtöv paşanın gəmilərini şikəst etdilər. Adı çəkilən paşa suya düşdü. Rəis Xaki cəldliyinin və çevikliyinin çoxluğu sayəsində çəngal ilə onu öz gəmisinə çıxardı. Qılıc Əli firənglərin üç ədəd gəmisini tutub salamatlıqla və qənimətlərlə o mərəkədən çıxdı. Kafirlər rumiləri təqib edib təxminən yüz yetmiş gəmini ələ keçirdilər. Rumilərdən Qara Xocanı, Rəis Qasımı, Rəis Salehi və Rəis Qaramanı bir çox digərləri ilə birlikdə qətlə yetirdilər. Pərtöv paşa pərişan və bədhal vəziyyətdə İstanbula gəldi[2587].

## Əsgəri xanın Knyaz İvanla müharibə etməsi[2588]

Bu il Krım valisi Əsgəri xan öz oğlu Dövlət Gəray xanla[2589] ittifaqda təbil və kosla Rusu fəth etmək üçün hərəkətə gəldi. Uluğ bəy [adı] ilə məşhurlaşmış Rus valisi Knyaz İvan o diyarın qoşunlarını cəmləyib onların üzərinə getdi. Aqa (Oka) çayından keçdi. Sərhəddə olan Səkə (Serpuxov)[2590] şəhərinə gəlib savaşa və vuruşa könül verdi (hazırlaşdı). Xanlar o ətrafa çatdıqda, iki qol tərtib edərək iki tərəfdən həmlə etdilər. Hərb atəşi alovlandı. Əsgəri xan[2591] bir dəstə atıcı ilə birlikdə aşağı endi və atışa başladılar. Ciyər deşən ox görmə nuru kimi gözdə və ağıl kimi beyində özünə yer tutur, şahmatdakı vəzir fiquru kimi hər tərəfə hərəkət edərək, süvarini yerə və piyadanı yəhərə tikirdi.

Beyt

"Zireh deşən vəfasız ox,
İgidlərin qanından qırmızı söyüdə döndü".

Ölüm ahəngli tüfəng, yandırıcı yara atəşini hərb meydanından Ülkər [ulduzuna] çatdırdı. Döyüş və vuruş əsnasında Dövlət Gəray xan mərdanə səylər və igidcəsinə həmlələr etdikdən sonra ruslar hücum çəkib onu əsir aldılar. Ona görə də Əsgəri xan[2592] fərar etdi. Kafirlər onları təqib edib bir çoxlarını qətlə yetirdilər[2593].

---

[2586] *Qurani-Kərim, "Təkvir" surəsi, 6-cı ayə.*
[2587] Bu döyüş Avropa mənbələrində Lepanto, Osmanlı qaynaqlarında isə İnebahtı savaşı adı ilə qeyd olunmuşdur.
[2588] Bakı nüsxəsi (262b) 981-ci il hadisələri buradan başlayır. Məclis nüsxəsi: "Rus diyarında baş vermiş hadisələr haqqında".
[2589] Bakı nüsxəsi: "Krım valisi Dövlət Gəray xan oğlu Sələmət Gərayla" (262b).
[2590] Bakı nüsxəsi: "Sərcuş"; London nüsxəsi: "Sitna".
[2591] Bakı nüsxəsi: "xanlar".
[2592] Bakı nüsxəsi: "əsgərlər".
[2593] Burada 1572-ci ilin 1 avqustunda, Moskvadan 60 km. cənubda, Serpuxov yolu üzərində yerləşən Molodi kəndi yaxınlığında Krım tatarlarının xanı I Dövlət Gəray xanın (1551-1577) ordusu ilə knyaz Mixail Vorotınskinin komandanlıq etdiyi rus qoşunları arasında baş vermiş vuruşmadan söhbət gedir. Bu döyüşdə ruslar qalib gəlmişlər. Lakin Həsən bəy Rumlunun bu hadisə haqqında məlumatında bəzi yanlışlıqlar var. Birincisi, Dövlət Gəray xanın atası Əsgəri xan deyil, Mübarək Gəray xan olmuş və o, 1517-ci ildə ölmüş, təbiidir ki, bu yürüşdə iştirak etməmişdi. İkincisi, Rus çarı İvan Qroznı bu döyüşə şəxsən qatılmamışdı. O, həmin vaxt Novqo-

### Özbəklər arasında baş vermiş hadisələr haqqında söhbət

Bu il Mirzə Əli bəy Nayman, Tənəm xandan üz döndərib, Buxaraya, Abdulla xanın yanına gedərək Bəlxi fəth etməyin asan bir iş olduğunu onun nəzərinə çatdırdı. Ona görə də [Abdulla] xan çoxlu ordu ilə Amudərya çayından keçib Bəlx ətrafında əzəmət və iqtidar çadırını dövr edən fələyə yüksəltdi. Tənəm xan qala divarları içinə sığındı. Təxminən səkkiz ay o azğın tayfa bir-biri ilə müharibə etdi. Axırda Tənəm xan əhd-peymandan və "Quran"a and-amandan sonra Hindüvan qalasından çıxıb [Abdulla] xanla görüşdü. [Abdulla] xan Bəlx hakimliyini Mirzə Əli bəy Naymana tapşırıb yağış damlalarından artıq sayda bir ordu ilə Əndixud və Şibirğana hərəkət etdi. O diyarın valisi Özbək sultan ibn Rüstəm xan ibn Canibəy sultan həmin ali mənşəli padşahın hərəkətindən xəbərdar olduqda, qılınc və nizə işlətməyərək, o məmləkətin gəlinini boşayıb (o məmləkətdən əl çəkib) [Abdulla] xanın xidmətinə tələsdi. Xan o qəsəbənin hakimliyini öz mülazimlərindən birinə tapşırıb Buxaraya yollandı.

### Müxtəlif əhvalatlar

Bu il asimanda, Şimal qütbü tərəfində ulduz rəngli bir atəş peyda oldu. [Bu vəziyyət] doqquz hilali ay müddətində davam etdi və axırda nəzərdən qeyb oldu. Bundan öncə Ənuşirəvanın atası Qubadın müasiri olmuş Rum padşahı Ənəs[2594] zamanında bu növ bir əlamət Şimal qütbündə ortaya çıxmış, yeddi ay davam etmiş, axırda kül şəklində aşağı tökülmüş, ondan sonra Rum vilayətində taun xəstəliyi baş qaldırmışdı.

Həmçinin bu il Qain şəhərində taxıl tamamən qəhətə çəkilmişdi. O məmləkətin əhalisinin əhvalı çətinliyə düşmüşdü. Buğdaya bənzər bir şey yağdı, camaat ondan çörək bişirdi və oranın hakimi Vəli bəy Ustaclu dinin pənahı olan şah üçün ondan göndərdi.

### Ölümlər

Həmçinin bu il ədalətin sığınacağı olan cənab, alimlərin və dərin biliklilərin öncülü Müslihəddin Lari Amid şəhərində fani aləmdən köçdü. Həyatının əyyamı təxminən doxsan il idi[2595]. Cənab Mövləvi (Müslihəddin Lari) Əmir Qiyasəddin Mənsur Şirazinin yanında tələbəlik şərtini yerinə yetirmişdi. Daha sonra Hindistan vilayətinə gedib Hümayun padşahın [sarayında] sədr oldu. Həmin ali məqamlı padşahın ölümündən sonra şərəfli Hərəmeynin ziyarətinə yollandı. Yol əsnasında gəmi sındı və dörd yüz cild kitabı tələf oldu. Mövlana (Müslihəddin Lari) tamam məşəqqətlə coşqun dənizin təlatümündən nicat sahilinə çıxıb İstanbul şəhərinə tələsdi. Rum padşahı Sultan Səlim ona qayğı göstərib axırda onu Amid şəhərinə göndərdi. Əsərləri sırasında bunlar vardır: "Haşiyə bər şərhi-müvafiq" ("Müvafiq şərhə dair haşiyə"), "Haşiyə bər haşiyeyi-qədimi-Mövlana Cəlaləddin Məhəmməd Dəvvani" ("Mövlana Cəlaləddin Məhəmməd Dəvvaninin qədim haşiyəsinə haşiyə"), "Haşiyə bər şərhi-Cami" ("Caminin şərhinə dair haşiyə"), "Haşiyə bər Ənvari-fiqhi-Şafei" ("Şafei fiqhinin nurları" əsərinə dair haşiyə"), təfsir haqqında "Şərhi-Şəmaili-Tirmizi" ("Tirmizinin "Şəmail" əsərinə dair şərh"), Təfsiri-sureyi-Əna-ənzəlna" ("Əna-ənzəlna[2596] surəsinin təfsiri"), indi Rum padşahı olan [Osmanlılar] haqqında "Tarixi-Ali-Osman" ("Osmanlı sülaləsinin tarixi"), "Risaleyi dər şətrənc" ("Şahmat haqqında bir risalə") və "Risaleyi dər baytari" ("Baytarlıq haqqında bir risalə").

---

rodda idi. Üçüncüsü, Dövlət Gəray xan əsir düşməmiş, sağ-salamat Krıma qayıtmışdı *(Н.М.Карамзин. История государства российского, т. IX, с.201-204).*

[2594] Burada Sasani şahı Qubadın müasiri olaraq adı çəkilən Rum padşahı Ənəs m. 491-518-ci illərdə hökmranlıq etmiş Bizans imperatoru I Anastasidir.

[2595] Digər bir məlumata görə, Müslihəddin Lari 979-cu ilin zilhiccə ayında (15.04 – 13.05.1572) altmış yaşında vəfat etmişdir *(Ч.А.Стори. Персидская литература, ч. 1, с.413).*

[2596] "Qurani-kərim"in "Qədr" surəsi nəzərdə tutulmuşdur.

## 981-Cİ İLDƏ[2597] (03.05.1573 – 22.04.1574) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

### Təbrizdəki əclafların qətli

Bu il Təbrizdəki əclaflarının qətli baş verdi. Səbəb odur ki, dinin pənahı olan şah Təbriz hakimliyini Şahqulu sultan Ustaclunun oğlu Allahqulu bəyə həvalə etmişdi. Vicuyə[2598] küçəsinin adamları onun mülazimini tutub çoxlu əziyyətlər etdilər. O, yardımçılarının və tərəfdarlarının azlığı üzündən tənəzzül edib üzrxahlıqla və ah-zarla öz mülazimini xilas etdi. Neçə gündən o, sonra bir təqsirkarı qətlə yetirdi. Öldürülən adamın qohumları onu Gəcil məzarlığında dəfn etdilər. Adı çəkilən cənab hakim onun qəbrini qazdırmaq istədi. Bir dəstə avara və lotu-potu o bədbəxtə maneçilik törətdilər. O, qılınc və mizraq işlətdikdən sonra fərar yolunu tutub öz evinə sığındı. Əclaflar kin qılıncını qılafdan sıyırıb onun bəzi mötəbər mülazimlərini yaraladılar və öldürdülər. Əclafların şeytanları zəbt şüşəsindən çıxdıqları üçün əllərini soyğun və qarətə uzatdılar. Onlar qadınları ərlərinin və qohumlarının [gözləri] önündə və oğlan uşaqlarını (qılmanları) ana-atalarının qarşısında zorlayaraq üzüqara və rüsvay edirdilər. Seyidlər, qazılar, əyan-əşrəflər, həqirlər və şəriflər, güclülər və zəiflər, varlılar və kasıblar (dərvişlər), qəriblər və şəhərlilər onların qorxusundan elə sərsəm olmuşdular ki, yazmaqla və deməklə onu şərh etmək mümkün deyil. İnsanlar arasında birlik və dostluq qalmamışdı. Hər küçədə əclaflardan biri istila bayrağını yüksəltdi: Pəhləvan Yari – Səncar məhəlləsində, Nəşmi – Vicuyə məhəlləsində, Topal Mustafanın oğlu Şərəf – Sərv məhəlləsində, Şeyxi Kardzən[2599] – Məhad-Məhində, Ağa Məhəmməd – Novbər məhəlləsində, Pəhləvan Əvəz – Meydanda, Aslan – Dərbi-Əlada, Mirzə Məlikani ilə Gögcə – Dəvəçilər məhəlləsində və Əlayi-Həsəncan – Şeşgilanda. Təxminən iki il bu bədbəxt qövm arasında davaqırğın oldu. Neçə dəfə əmirlər və dövlət ərkanı bu dövlətsiz tayfanın dəf olunmasının vacib olduğunu əşrəfə ərz etsələr də, dinin pənahı olan şah onların sözünə qulaq asmadı və düşündü ki, bəlkə, onlar fitnə-fəsadı tərk etsinlər və beləliklə də, möhtac rəiyyət qətl olunmasın, belə bir mülk viran qalmasın. O qaragünlər bundan əsla dərs almadılar və son dərəcə zalımlıq və cəhalət üzündən tüğyan və üsyanda israr etdilər. Nəhayət, dinin pənahı olan şah ağılda, müdriklikdə, fəhmdə və fərasətdə tay-tuşlarından üstün olan Yusif bəy Ustaclunu Təbrizə hakim göndərdi.

Şeir

“Hikmət əhlinin fikri kimi uzaqgörəndi,
Aqibəti düşünənlərin təbiəti kimi əmindi.
Müdriklərin rəyi kimi məqsədə müvafiqdi,
Bir tədbir ilə yüz qoşunu məğlub edərdi”.

Onun (Yusif bəyin) lətifliklərin nəzmindəki gözəl sözləri şərbət kimi dadlı idi[2600] və onun nəzəri incəliklərin həllində işıq saçan bir atəş idi. O, əclaflara bir də müxaliflik etməyəcəkləri barədə and içdirdi və onları kətxudalara zamin verdi. Neçə aydan sonra Pəhləvan Yari müxalifliyə başlayıb hakimin mülazimlərindən iki nəfəri[2601] qətlə yetirdi. Ona görə də əclaflar fitnə və fəsad qaldırdılar.

Nəzm

“Bir fitnəkar ucbatından iş qarışdı,
Yetərincə fitnə qalxdı hər guşədə.
Minlərlə fədai cuşa gəldi,
Qorxunc fillər kimi hay-küy saldı”.

---

[2597] Bakı nüsxəsi: “982-ci”.
[2598] Bakı nüsxəsi: “Vəricuyə”; Baroda nəşri: “Dərcuyə”. Bəzi mənbələrdə Delcuyək kimi də yazılmışdır *(Tarixi-aləmarayi-Abbasi, I c., Bakı, 2009).*
[2599] Kardzən – “bıçaq vuran” deməkdir. Ə.Nəvai (s.1484) bu şəxsin Şeyxi Gazər ola biləcəyini ehtimal edir.
[2600] Yusif bəy Ustaclu həm də şair idi.
[2601] Nuruosmaniyyə və Məclis nüsxələri: “iki-üç nəfəri”.

Ona görə də Yusif bəy ali taxtın ətəyinə bir ərizə göndərdi ki, o qövmün sayı dörd yüz nəfərdən[2602] artıq deyildir. Həmçinin o cənnət nişanlı şəhərin böyükləri və əhalisi onlardan son dərəcə şikayət etdilər və dedilər:

Şeir

"Ey dünyanın bəzəyi, ey iqlim tutan [şah],
Bunların zülmündən şeypur səsləndi[2603].
Onların əlindən cahan pərişan oldu,
Bu mülkün xarabalığının səbəbi onlardır".

Üləma da onların qətlinə fitva verdi. Ona görə də hökmdar fərman verdi ki, Xəlifə Ənsarın oğlu Söhrab bəy çoxlu qoşunlarla Yusif bəyə kömək etməyə getsin və onun sözündən çıxmasın. Elə ki həmin ordu səf bağlayıb Sahibabad meydanına gəldi, Yusif bəy də savaş əhlindən [ibarət] bir dəstə ilə onlara qoşuldu. Heyrət və dəhşət tüstüsü əclafların beyninə yol tapdı. Alçaqlar və onların sərdarı Yari ov heyvanları kimi hansı tərəfə üz çevirdilərsə, xilas və nicat yolunu bağlı gördülər, can qorxusundan dəlmə-deşikdə gizləndilər. Yusif bəy zaminləri tutub onlara təzyiq göstərməyə başladı. Onlar (zaminlər) təhqiqat aparıb, onların (üsyan başçılarının) əksərini ələ keçirərək qətlə yetirdilər. Avaraların, lotu-potuların, ədəbsizlərin və rəzillərin sərdarlarından Gögcəni, Nəşmini, Şərəfi, Şeyxi Gazəri, Çəkməçi Həsəni, Uzun Hacını, Şahəli Çərtəki, Mirzə Babaqulunu və Göysatan Həsəni[2604] dar [ağacından] asdılar. Bunlardan savayı, təxminən yüz əlli nəfər qətlə yetirildi. Yari, Pəhləvan Əvəz və Əlayi-Həsəncan[2605], Söhrab bəyin evində məhbus idilər. Onlar Söhrab bəyə rüşvət vermişdilər və o, onları himayə edirdi. Axırda Yusif bəy əqli və nəqli dəlillərlə Söhrab bəyi inandırdı. Onları Yusif bəyin mülazimlərinə təslim etdilər. Öldürüldükdən sonra onların başlarını Təbriz meydanında dara çəkdilər. Ona görə də həmin qövmün fitnə atəşi yatdı.

Nadir təsadüflərdən [biri] odur ki, Pəhləvan Əvəz üç il müddətində bir qarmaq saxlamışdı. Dar ağacı düzəldilən vaxt o qarmağı çıxarıb dara bağladı. Onun başı dara çəkilən gün həmin qarmağa bənd edildi[2606].

### Cəlaləddin Əkbər padşahın Gücəratı tutması haqqında söhbət

İlin əvvəllərində Cəlaləddin Əkbər padşah Gücərat diyarına hərəkət etməyi və o diyarın hakimlərini ən kəskin tərzdə cəzalandırmağı qərara aldı. Yüksək səviyyəli əmirlərlə və qılınc vuran, nizə oynadan bahadırlardan ibarət bir tayfa (dəstə) ilə sürətli yürüş ("ilğar") etdi. Yol əsnasında Sultan Hüseyn mirzə Bayqaranın nəvələrindən olan Məhəmməd İbrahimlə qarşılaşdı. Böyük bir döyüş baş verdi. Məhəmməd İbrahim ürəyinin qorxusundan fərar yolunu tutdu. Müzəffər padşah Gücəratın paytaxtı olan Əhmədabad şəhərinə daxil olub, o diyarın hakimliyini Mirzə Əziz Kukəyə həvalə edərək Aqra şəhərinə qayıtmaq üçün bayraq yüksəltdi.

Tərifəlayiq xüsusiyyətlərə malik padşahın [orada] olmadığı zaman Gücərat valisi Məhəmməd Hüseyn mirzə hamısı fil yıxan və aslan ovlayan [cəngavərlərdən ibarət] çoxlu ordu ilə döyüş və vuruş əzmi ilə Əhmədabad ətrafına gəldi. Bu xəbər alicənab padşaha çatdıqda, Aqradan çıxıb sürətlə yürüş etdi. Belə ki, doqquz gündə Əhmədabad şəhərinə çatdı. O vaxt Mirzə Əziz Kukə, Məhəmməd Hüseyn mirzə ilə dava-dalaşda idi. O, bir anda həmin yaramaz ordunu tar-mar etdi. [Cəlaləddin Əkbərin] atəş saçan qılıncının şimşəyi onun (Məhəmməd Hüseyn mirzənin) qoşununu qamışlıq kimi yandırdı. Məhəmməd Hüseyn mirzə xilassız bir əsarətə və qurtuluşsuz bir qəhrə giriftar oldu. Bu fəthdə zəfər şüarlı qoşunun əlinə saysız dirhəmdən, dinardan və cavahirdən [ibarət] bol qənimət və sonsuz nemət düşdü. Padşah o diyarın hakimliyini Mirzə Əli Kukəyə həvalə edib Aqraya qayıtdı və bəlağət şüarlı münşilər, fərmana uyğun olaraq, fəthnamələr yazıb Hindistanın [müxtəlif] tərəflərinə göndərdilər.

---

[2602] Burada sıravi iştirakçılar deyil, üsyanın fəalları və təşkilatçıları nəzərdə tutlmuşdur.

[2603] Şeypur səslənməsi qiyamətin qopmasının əlamətidir.

[2604] Bakı nüsxəsi: "Hüseyn". Bəzi digər mənbələrdə də bu şəxsin adı Hüseyn kimi yazılmışdır (bax: *S.Onullahi. XIII-XVII əsrlərdə Təbriz şəhəri. Bakı, 1983*). Məclis nüsxəsi: "Mirzə Dədəqulunu, Şahnəzər Qibləni və göysatan Kor Həsəni".

[2605] Bakı nüsxəsi: "Əlayi-Hüseyncan".

[2606] Burada haqqında bəhs olunan Təbriz üsyanı 1571-1573-cü illərdə baş vermişdir. Bu üsyan haqqında daha ətraflı bax: *И.П.Петрушевский. Восстание ремесленников и городской бедноты в Тебризе в 1571-1573 гг. // ССИА, вып. I, Баку, 1949, с.214-224; S.M.Onullahi. XIII-XVII əsrlərdə Təbriz şəhəri. Bakı, 1983, s.179-182; М.Х.Гейдаров. Социально-экономические отношения, с.143-145.*

### Müxtəlif əhvalatlar

Həmçinin bu il darülirşad Ərdəbildə taun epidemiyası baş verdi. Şəhərdən, şəhər xaricindən və nahiyələrdən otuz min nəfər torpaq niqabını üzlərinə örtdü (öldü).

Həmçinin bu il dinin pənahı olan şah ali divanın vəzirliyini Seyid Həsən Fərəhaniyə və Xoca Cəmaləddin Əli Təbriziyə həvalə etdi, ali divanın müstövfiliyinə Mirzə Şükrulla İsfahanini təyin etdi və onların hər biri üçün məvacib olaraq beş yüz Təbriz tüməninde məbləğ təyin edildi.

### Ölümlər

Həmçinin bu il tədqiqatçıların öncülü və müasirlərin ən fəzilətlisi Mövlana Abdulla Yəzdi Ərəbistanda dünyadan köçdü. Cənab Mövləvi, Xoca Cəmaləddin Mahmudun yanında tələbəlik şərtini yerinə yetirmişdi. Onun mübarək qələminin məhsulu [olan əsərlər] sırasında bunlar vardır: “Haşiyə bər haşiyeyi-qədimi-Mövlana Cəlaləddin Məhəmməd Dəvvani” (“Mövlana Cəlaləddin Məhəmməd Dəvvaninin qədim haşiyəsinə dair haşiyə”) və “Şərh bər təhzibi-məntiq” (“Məntiq təliminə dair şərh”).

### 982-Cİ İLDƏ (23.04.1574 – 11.04.1575) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il dinin pənahı olan şahın fərəhli və mübarək səhhəti pisləşdi. Onun bəyənilmiş xüsusiyyətlərə malik zatını yandırıcı qızdırma bürüdü. Ürəklər həyəcanlandı, könüllər pərişan oldu. Əmirlər və dövlət ərkanı arasında neçə dəfə münaqişə və düşmənçilik baş verdi. Elm və maarifin kamalı ilə ayın çöhrəsindən cüzamı təmizləyən, təcrübə və məharət bolluğu ilə günəşin surətindən sarılığı aparan Mövlana Qiyasəddin Əli mülayim və müvafiq şərbətlə xəstəliyi aradan qaldırdı.

Şeir

“Şərqin şahı o bəhrdən içmişdir səadət şərbətini,
Ta saflaşsın bədəninin cövhəri ruh kimi.
Bu zəhmətə nə hacət var, çünki ona bəxş edilmiş,
İsa canı kimi bir bədən, Nuh ömrü kimi bir müddət”.

Camaat təzə can tapıb ehtiyac sahiblərinə nəzirlər və sədəqələr verdi.

Həmçinin bu il Portuqal [adı] ilə məşhur olan Firəng padşahı Dan Sebastin[2607] öz elçilərini müşahidə zamanı nəzər-diqqət əhlinin gözünü qamaşdıran töhfələr və hədiyyələrlə aləmin pənahı olan dərgaha göndərdi. Bundan öncə onlar (portuqallar) məscidlərin xaraba qoyulması və “Kəlami-məcid”in (“Qurani-kərim”in) yandırılması kimi neçə-neçə ədəbsizlik törətdikləri üçün [şah] elçilərə iltifatlı nəzərlərlə baxmadı və bir sıra əmirlərə o dövlətsiz qövmü ədəbləndirməyi həvalə etdi[2608].

### Ölümlər

Sultan Səlim ibn Sultan Süleyman ibn Sultan Səlim ibn Sultan Bayəzid ibn Sultan Məhəmməd ibn Sultan Murad ibn Sultan Məhəmməd ibn İldırım Bayəzid ibn Sultan Murad xan ibn Orxan ibn Sultan Osman ibn Ərtoğrul ibn Süleyman ibn Qaya Alp ibn Qızıl Buğa ibn Bayandur ibn Əculəce ağa ibn Toğan ibn Qeyd Sevən (Sun) ibn Nuyqur ibn Baqi Ağaib ibn Sevincəq ağa ibn Toxtəmür ibn Yusati ibn Gög Əli ibn Oğuz ibn Qaraxan[2609] bu il, ramazan [ayının] 6-da (20.12.1574) İstanbul şəhərində əbədiyyət aləminə yollandı[2610]. Və-

---

[2607] Həmin elçilik gələn zaman Portuqaliya kralı Don Sebastiyan (1557-1578) idi.

[2608] Bu elçilər yalnız Şah Təhmasibin vəfatından sonra öz ölkələrinə geri qayıtmaq üçün icazə ala bildilər *(Nəvai, şərhlər, s.1489).*

[2609] Burada Həsən bəy Rumlu tərəfindən sadalanan Osmanlı dövlətinin banisi Osman Qazidən Qaraxana qədərki şəcərənin adları Aşiq Paşazadə tarixində daha dəqiq əksini tapmışdır: Osman Qazi ibn Ərtoğrul Qazi ibn Süleyman şah Qazi ibn Qaya Alp ibn Qızıl Buğa ibn Bayıntur ibn Aykoluğ ibn Toğar ibn Qaynıtur ibn Sunqur ibn Baqıyı ibn Suğar ibn Toktemür ibn Basuq ibn Gög Alp ibn Oğuz ibn Qaraxan... *(Âşık Paşazade. Osmanoğullarının tarihi. Hazırlayanlar: Kemal Yavuz, M.A.Yekta Saraç. İstanbul, 2003, s.53,321).* Şəcərənin fərqli versiyaları üçün bu mənbələrə baxa bilərsiniz: *Mehmed Neşrî. Kitâb-ı Cihan-Nümâ. Yayınlayanlar: F.R.Unat, M.A.Köymen. I c. Ankara, 1987, s.54-57; Həsən Mahmud oğlu Bayati. Cami-Cəm-ayin. Hazırlayan: İ.Osmanlı. Bakı, 2011, s.37-45.*

[2610] Digər bir məlumata görə, II Səlim 27 şaban 982 / 12 dekabr 1574-cü ildə vəfat etmişdir *(J.V.Hammer. Osmanlı tarihi, II c., s.140).*

ziri-əzəm Məhəmməd paşa[2611] onun ölümünü əmirlərdən və dövlət ərkanından gizli saxlayıb, Sultan Muradı qəflətən şəhərə gətirərək səltənət taxtına oturtdu və o, bütün qardaşlarını həlak etdi. Bu sülalədən on dörd nəfər səltənət sürmüşdür.

Sultan Osman – dövlətinin əvvəli 689-cu (1290) ildir. Ölümü 727-ci ildə (27.11.1326 – 16.11.1327) [baş vermişdir]. Səltənət əyyamı otuz səkkiz ildir. Fəth etdiyi vilayət: Qarahisar[2612], İznik şəhəri, Bursa şəhəri.

Orxan – səltənəti 727-ci (1326-27) ildə [başlamışdır]. Ölümü 759-cu ildə (14.12.1357 – 02.12.1358) [baş vermişdir]. Səltənət müddəti otuz iki ildir. Fəth etdiyi vilayət: Akyazı, Bolu, Mudurnu, Trakya, Nikomediya, Taraqlı, Balıkəsir, Ulubat, Gelibolu[2613].

Sultan Murad – cülusu 759 (1357-58), ölümü 791-ci ildə (1389) [olmuşdur]. Səltənət müddəti otuz ildir. Fəth etdiyi vilayət: Ankuriyyə (Ankara), Sultan köyü, Dimetoka, İpsala, Ədirnə şəhəri, Keşan vilayəti, Gümülcinə, Biğa, Həmid vilayəti, Gərmiyan, Serez, Qarafəryə, Masirə, Selanik vilayəti[2614].

İldırım Bayəzid – cülusu 791 (1389), ölümü 805-ci ildə (01.08.1402 – 20.07.1403) [olmuşdur]. Səltənət müddəti on dörd ildir. Fəth etdiyi vilayət: gümüş mədəni olan Kratova, Deni, Alaşəhər, Saruxan eli, Aydın eli, Nigbolu, Seliseli, Sivas şəhəri, Malatya şəhəri, Qaraman vilayətinin yarısı, Taraqlı[2615].

Əmir Süleyman – hakimiyyətinin əvvəli 805-ci ildir (1402-03). 812-ci ildə (16.05.1409 – 05.05.1410) qətlə yetirilmişdir. Səltənət müddəti yeddi ildir.

Musa Çələbi – Sultan Məhəmmədlə şərikli üç il səltənət sürmüşdür.

Sultan Məhəmməd – səltənəti on üç ildir. Ölümü 825-ci (1422) ildə [baş vermişdir].

Sultan Murad – cülusu 825 (1422), ölümü 855-ci ildə (03.02.1451 – 22.01.1452) [baş vermişdir]. Səltənət əyyamı otuz ildir. Tutduğu vilayət: Məntəşa eli, Saruxan eli, Aydın eli, Sivrihisar, Büruc, Semendire, Novaberi, Qocacıq-hisar[2616].

Sultan Məhəmməd – cülusu 855 (1451-52), ölümü 886-cı ildə (02.03.1481 – 19.02.1482) [baş vermişdir]. Zəbt etdiyi vilayət: İstanbul şəhəri, Bosna vilayəti, Arnavut vilayəti, yeddi şəhərdən [ibarət] Qaraman vilayəti, Qəstəmoniyyə (Kastamonu), Sinop və Cəzirətül-üşşaqdan [ibarət] İsfəndiyar vilayəti, Xersek vilayəti, Kəfə şəhəri, Mora, Ağrıboza, Midilli adası, Qarahisar, Caniki-əla, Caniki-süfli, Əlaiyyə (Alanya) vilayəti, Torul adası, Qoyunluhisar, İnos vilayəti, Zərniq vilayəti, Amasra vilayəti, Qüznovoğlu[2617] vilayəti, Mənkub vilayəti. [Onun fəth etdiyi] vilayətlərin təfsilatı bundan öncəki cilddə yazılmışdır.

Sultan Bayəzid – cülusu 886 (1481-82), ölümü 918-ci ildə (19.03.1512 – 08.03.1513) [baş vermişdir]. Səltənət müddəti otuz iki ildir. Fəth etdiyi vilayət: Ağkirman, İnəbəxti adası, Karon, Madon, Kili qalası[2618].

Sultan Səlim – cülusu 918 (1512-13), ölümü 926-cı (1520) ildə [baş vermişdir]. Fəth etdiyi vilayət: Şami-Ülya (Yuxarı Şam), on yeddi[2619] şəhərdən [ibarət] Şami-Süfli (Aşağı Şam), iyirmi yeddi şəhərdən [ibarət] Misir vilayəti, səkkiz şəhərdən [ibarət] Diyarbəkr vilayəti, Mərəş vilayəti və Əxlata qədər Azərbaycanın bəzi yerləri. Hərəmeyni-Şərifeyndə hörmət və ehtiramla onun adına xütbə oxumuşlar.

---

[2611] Sokullu Mehmed paşa nəzərdə tutulur.

[2612] Qarahisar – İznik-İzmit yolu üzərində yerləşən Trikokiya qalası nəzərdə tutulur.

[2613] Akyazı və Taraklı – Türkiyənin Sakarya vilayətinin ilçələridirlər. Bolu – Türkiyənin Qərbi Qara dəniz regionunda vilayət mərkəzi. Mudurnu – Bolu vilayətinin bir ilçəsi. Trakya – indiki Bolqarıstanın cənub-şərqini, Yunanıstanın şimal-şərqini və Türkiyənin Avropa hissəsini əhatə edən tarixi vilayət. Nikomediya – Anadolunun şimal-qərbində yerləşən İzmit şəhərinin əvvəlki adı. Balıkəsir – Türkiyənin Mərmərə regionunun Anadolu tərəfində vilayət. Ulubat – hazırda Bursa vilayətinin Karacabey ilçəsinin bir kəndidir. Gelibolu – Türkiyənin Dardanel boğazının Avropa sahillərində bir yarımada.

[2614] Sultanköy – Türkiyənin Tekirdağ vilayətinin Marmaraereğlisi ilçəsində sahil kəndi. Dimetoka – Yunanıstanın şimal-şərqində, Qərbi Trakya bölgəsində bir rayon. İpsala və Keşan – Türkiyənin Ədirnə vilayətinin ilçələridir. Gümülcinə - Yunanıstanın Qərbi Trakya bölgəsində şəhər. Biğa (Biga) – Türkiyənin Çanakkale vilayətinin bir ilçəsi. Qarafəryə (Veriya) – Yunanıstanın Orta Makedoniya bölgəsində şəhər.

[2615] Kratova – Makedoniyanın şimal-şərqində qəsəbə. Alaşəhər (Alaşehir) – Türkiyənin qərbində, Manisa vilayətinin bir ilçəsi. Seliseli – Bolqarıstanın şimal-qərbində, Dunay sahilində, Rumıniya ilə sərhəddə yerləşən Silistre şəhəri.

[2616] Novoberi – Kosovanın şərqindəki Novoberda qəsəbəsi. Qocacıq-hisar – Makedoniyanın qərbində yerləşir.

[2617] Məclis nüsxəsi: "Qerlovoğlu".

[2618] Kili (Kiliya) – Ukraynanın Odessa vilayətində rayon.

[2619] Məclis nüsxəsi: "on səkkiz".

Sultan Süleyman – səltənətinin əvvəli 926-cı (1520) ildə [olmuş], ölümü 974-cü ildə (19.07.1566 – 07.07.1567) [baş vermişdir]. Səltənət əyyamı qırx səkkiz ildir. Tutduğu vilayət: İraqi-Ərəb, Bəsrə, Şəhrizur, Qətif, Ləhsa vilayəti[2620], Yəmən şəhərlərinin bəziləri, Sevakin[2621] vilayəti, Gürcüstandan Daveli, Azərbaycandan Van qalası və Əxlat ətrafı və yan-yörəsi ilə birlikdə, Kürdüstandan Bitlis, Firəng diyarından Belqrad, Rodos, Engirüs padşahının paytaxtı Budin, Saqqız adası, Məğrib-zəmindən Trablis şəhəri, Cəzirə (Əlzəcair) şəhəri və bəzi ərəb adaları.

Sultan Səlim – hakimiyyətinin əvvəli 974-cü (1566-67) ildir. Ölümü 982-ci ildə (23.04.1574 – 11.04.1575) [baş vermişdir]. Səltənət müddəti səkkiz ildir. Fəth etdiyi vilayət: Kıbrıs adası və Aqilbənd qalası[2622].

Təsadüf elə gətirmişdir ki, adı Səlim olanlar səkkiz il və Murad adında olanlar otuz il səltənət sürmüşlər. Bayəzid adında olanlar isə dustaq edilmişlər. İldırım Bayəzid Əmir Teymura [əsir olmuş], Sultan Bayəzid [isə] Sultan Səlimin əlində dustaq olmuşdur. Padşah olmayan III Bayəzid Qəzvində giriftar olmuşdur.

Həmçinin bu il, bir müddət küfr və zəlalət çölündə sərgərdan olan Ləvənd ibn Gürgin vəfat etdi. Ləvənd ibn Gürginin[2623] oğlu Keyxosrov əmirlik xalçası üzərində oturdu. [Keyxosrovun qardaşı] Aleksandr Qəzəq adlı yerə pənah apardı. Keyxosrov digər aznavurlarla Qəzəqə yollandı. Aleksandr cövşən geymiş qoşunlarla o bədbəxt güruhun üzərinə yürüdü. O iki kinli ordu bir-birinə çataraq igidlik qılıncını sıyırdılar. Onların arasında şiddətli bir vuruşma baş verdi.

Keyxosrov o davada qətlə yetirildi. Aleksandr atasının yerinə hökumət kürsüsündə qərar tutdu. O, öz mülazimlərini dəniz və qurunun hökmdarının (Şah Təhmasibin) dərgahına göndərib [bildirdi] ki, “mən [sənə] qulamam”. [Şah] Seyid Məsum bəy Səfəvini[2624] xələt, tac, kəmər və qızıl yəhərli atla [Aleksandrın yanına] göndərib Gürcüstanın hakimiyyətini ona bəxş etdi.

Öz zamanının məşhurlarından olan Mirzə Qasım Gunabadinin ruh quşu bu il bədən qəfəsini sındırıb müqəddəslik bağlarına (cənnətə) pərvaz etdi. Sözügedən şəxsə “Şahnamə” [əsərinin yazmasının müqabilində] mükafat vermədiklərinə görə şikayətlə demişdir:

“Kəsmişəm qələmin tamah dilini,
Çünki xasiyyəti budur “Şahnamə”nin.
Acgöz alçaqlar üzündən dövlətsiz qalmışam,
Son dərəcə zəbunluqda və pis güzəranda qalmışam.
Bu dövran bağında ki, yarpaqsız deyildir,
Xəsislərin bəxşişi ölümdən az deyildir”.

Mənzum əsərlərindən: “Şahnameyi-Həzrəti-Şah İsmayıl” (“Həzrət Şah İsmayılın şahlıq kitabı”), “Şahruxnamə” (“Şahrux [haqqında] kitab”), “Leyli və Məcnun”, “Guy və çovqan” (“Top və çovqan”).

## 983-CÜ İLDƏ (12.04.1575 – 30.03.1576) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Ulduzlar xosrovu (günəş) yazın mötədil nöqtəsinə çatdıqda lalə və yaşıllıq bağda və çəməndə baş qaldırdı.

Nəzm

“Lalə yerin altından boy atıb çıxdı,
Necə ki, ipək sap gövhər düyünündən çıxar.
Əyandır gülün surəti saf su üzərində,

---

[2620] Ləhsa – Ərəbistan yarımadasının İran körfəzi sahillərində coğrafi bölgə.

[2621] Sevakin (Suakin) – Sudanın şimal-şərqində, Qırmızı dəniz sahilində şəhər.

[2622] Aqilbənd və ya Ağılbənd – Əsl adı Halkulvad. Tunis şəhərinin 9 km. şərqində yerləşir. Xalq arasında Aqilbənd və ya Ağılbənd adı ilə tanınmışdır *(Kâtip Çelebi. Tuhfetu’l-Kibâr fî Esfâri’l-Bihâr / Deniz savaşları hakkında büyüklere armağan. Yayına hazırlayanlar: S.Çakmakcıoğlu, Ç.Şan. İstanbul, 2007, s.415)*.

[2623] Tehran çapından səhvən “Gürgin ibn Ləvənd” yazılmışdır. Aleksandr 1574-cü ildə Torq adlı yerdə ögey qardaşlarını (Elimurza, Xosrov və Vaxtanq) məğlub edib öldürərək Kaxetiyada hakimiyyətə gəlmişdir və 1604-cü ilə qədər Kaxetiya hakimi olmuşdur *(Вахушти Багратиони. История царства грузинского /перевел, снабдил предисловием, словарями и указателем Н.Т.Накашидзе/. Тбилиси, 1976, с.138-143).*”Əhsənüt-təvarix”in Tehran nəşrində Torq əvəzinə Qəzəq yazılmışdır. Bu iki ifadənin ərəb qrafikalı əlifba ilə yazılışında bənzərlik vardır. Ç.N.Seddon isə bu toponimi Qürq şəklində oxumuşdur *(Baroda nəşri, II c., s.201)*.

[2624] Qeyd olunduğu kimi, Məsum bəy Səfəvi h. 976-cı ildə həlak olduğuna görə burada onun adının anılması yanlışlıqdır.

Hind ipək parçası (dibayi-hindi) və al-tamğa kimi.
Qönçənin əksi qabarıq düşüb suyun üstünə,
Lakin bu əks suda başı aşağı əksini tapıb".

Bu ilin əvvəllərində Abdulla xan Özbək Bəlx, Buxara və Hisari-Şadman əsgərlərini cəmləyib, köçha-köçlə Qərcistana hərəkət edərək Kuhək çayı kənarında dayanıdı. O tərəfdən Büraq xanın oğlu Baba sultan qardaşları ilə ittifaqda rəvan qumdan və biyaban qarışqasından daha artıq sayda alacılar[2625] qoşunu ilə düşmənin üzərinə yeridi. Kuhək çayı qalibiyyətli ordunun dayanacaq yeri olduqda, özbəklər Baba sultanın əmri ilə sal körpü bağlayıb [çayı] keçdilər. Bu möhnətli xəbər Abdulla xana çatdıqda onun mətin ayağı sarsıldı və fərar etdi. O, ilan kimi həmlə edən ordunun qorxusundan, heç olmasa qarışqanın gözü boyda bir xilas yolu axtardı və sayı qarışqa qədər olan ordunun xofundan milçək kimi qanad açıb aradan çıxdı.

Beyt

"Cahanı vadi-vadi dolaşdı,
Pəri (kabus) kimi gözlərdən itdi".

Baba sultan, qardaşı Dərviş xanın nifaqı səbəbindən öz diyarına qayıtdı, əmirlərin və dövlət ərkanının məsləhəti ilə Dərviş xanı tutub Daşkənd vilayətini ələ keçirdi.

**Müxtəlif əhvalatlar**

Bu il əsilzadəlik zivəri, əsil-nəsəb zinəti, xanədanının ululuğu və sülaləsinin şərəfi ilə bəzənmiş Xarəzm valisi Hacım xan öz oğlu Məhəmmədqulu sultanı ali taxtın ətəyinə göndərdi. Ali dərəcəli şahzadələr, əmirlər və dövlət ərkanı [onu] qarşılamağa tələsib izzət və ehtiramla onu fələyin qulamlıq etdiyi dərgaha gətirdilər. Dinin pənahı olan şah ona qızılla tikilmiş xələtlər, zərbafta paltarlar, tac, qızılla işlənmiş qılınc kəməri, at, qatır, dinar və dirhəm hədiyyə etdi.

## 984-CÜ İLDƏ (31.03.1576 – 20.03.1577) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

**Dinin pənahı olan şahın fani aləmdən əbədi cahana köçməsi**

Bu il dinin pənahı olan şahın zatının cövhərini xəstəlik təzahürü bürüdü. Bədən məmləkətinə hökm edən təbiət qəhrəmanı (Şah Təhmasib) yaxşı əhvaldan və sağlam səhhətdən məhrum oldu. Onun cismani qüvvələrin daşıyıcısı olan həyat ruhu süstlük tapdı. Hərçənd Mövlana Qiyasəddin Əli Kaşi və Mövlana Sədrüşşəriə Gilaninin oğlu Əbu-Nəsr kimi Məsih nəfəsli həkimlər və məharətli təbiblər müalicədə səy göstərsələr də, bir fayda hasil olmadı. Müsəlmanların qüssəsi kimi xəstəlik də gündən-günə artdı. [Şahın] qüvvəsinə (sağlamlığına) günbəgün nöqsan yol tapdı.

Nəzm

"Bu dəqiqədə mat qaldılar cümlə həkimlər,
Hansılar ki, "kün fəyəkün"[2626] kimi adam sağaldandırlar.
Elə ki nəbzin üslubu doğru hərəkətdən sapdı,
Acizlik çalasına düşdü Əflatunun (Platonun) ayağı.
[Şahın] sağlam təbiəti fəsad səmtinə üz çevirdi,
Qaldı bihudə Əbu-Əlinin əlində "Qanun" kitabı"[2627].

Fələkdən gələn sədadan və mələkdən gələn nidadan onun huş qulağına çatdı:

Şeir

"Bu fani səbatsızlıq müşkülündən,
Üz tutub gəl əbədiyyət mülkünə!

---

[2625] Mətndə "alacılar" yazılmışdır. Bəlkə də, burada "allahçılar" nəzərdə tutulmuşdur. Allahçılar – Orta Asiyanın Fərqanə vadisində yaşayan sufi topluluğudur (bax: *A.Yaman. Allahçılar. İstanbul, 2006*).
[2626] "Qurani-Kərim"in "Bəqərə" surəsinin 117-ci ayəsinə görə, Allahın bircə "kün" (ol!) əmri ilə kainatı yaratmasına işarədir. Həsən bəy Rumlu demək istəyir ki, Allah kainatı bir sözlə yaratdığı kimi, həmin həkimlər də xəstəlikləri bir sözlə müalicə edə biləcək qədər istedadlı idilər.
[2627] Bu misrada "Qanun" adlı təbabət kitabının müəllifi olan məşhur həkim və alim Əbu-Əli İbn-Sinaya işarə edilmiş və onun əsərində yazılan müalicə üsullarının Şah Təhmasibi xilas edə bilmədiyi göstərilmişdir.

Asimanın qübbəsinə bayraq vur,
Laməkan vadiyə qədəm qoy!
Qədim məmləkətə addım at,
O müqəddəs yerə ağlını, ürəyini, canını qoy".

Bu üzdən o taxt-tac sahibi, cavan və qocaya lazım olan qaçılmaz [ölüm] hadisəsinə könül verdi. Seşənbə günü, səfər ayının 15-də (14.05.1576) onun fəthlərlə dolu ruhunun şahbazı o səbatsız qəfəsin darısqallığından müqəddəs aləmə pərvaz etdi.

Beyt

"Getdi vəfasız dünyadan Süleyman məkanlı şah,
Yolunun dəlili oldu Pərvərdigarın rəhməti.
Öz xələfinə qoydu şahənşahlıq taxtını,
Buraxdı taxt-tacı səfər ayında, baharda.
Etdim düşüncədən mən sual ölüm tarixini,
Söylədi: De ki, 984-cü il idi".

Əbu-Nəsr müalicə zamanı xəyanət etdiyi üçün[2628] öz varlıq vərəqlərini ölüm küləyinə verdi. O həzrətin (Şah Təhmasibin) ömrünün əyyamı altmış dörd il, bir ay, on doqquz[2629] gündür. Səltənət müddəti əlli üç il, altı ay, iyirmi altı gündür. Bundan başqa, Şah İsmayılın himayəsi altında səkkiz il Xorasanda səltənət sürmüşdür.

Beyt

"Əgər yüz il qalsan da, yenə bir gün,
Gərəkdir ki, gedəsən bu ürək açan qəsrdən".

İslamda Müstənsir Billah Ələvidən[2630] savayı heç kəs bu qədər səltənət sürməmişdir. İranda Bəhram Gurun[2631] zamanından ta hicri tarixinin 985-ci il (21.03.1577 – 09.03.1578) olduğu indiki vaxta qədər təxminən min iki yüz il ərzində bir kimsə bu qədər səltənət sürməyibdir.

Xülasə, eyş və şadlıqla İrəm səhnəsi kimi xəndan olan bir şəhər (Qəzvin) sura bənzər bir bəla ilə qiyamət meydanı kimi coşub gurladı. İnsan tayfaları arasında böyük [qiyamət] gününün nümunəsi və məhşər çölünün əlaməti müşahidə olundu. Mənzillərə hay-küy və vəlvələ düşdü. Onun (Şah Təhmasibin) fərağından camaatın gözü qanlı su axıtdı. Ruzigar həsrət dırnağı ilə amal çöhrəsini cırdı. Adamlar heyrət dənizinə düşdülər. Qəm-qüssə karvanları cavanın və qocanın könül fəzasına yük apardı. Seyidlər, qazılar, üləma, rəiyyət və bütün xalq şamın dili kimi öz həyatları üçün titrəməyə başladılar ki, ta ömürlərinin son gününəcən siyasət bıçaqlarının kəsiciliyindən nə cür xilas olacaqlar (yəni Şah Təhmasibin ölümündən sonra başlarına nə gələcəyi barədə həyəcanlanmağa başladılar).

Amma Şamxal sultan Çərkəz çoxlu adamla basqın etmək məqsədi ilə tövlə meydanına gəldi. Əmirlər, dövlət ərkanı və əyan həzrətləri öz mənzillərini möhkəmləndirdilər. Ta o zamana qədər ki, fələyin aslan minən süvarisi (günəş) ləl surətli qılıncı qından sıyırdı, paslı asimanın üzündən qırmızılıq sipərini pak etdi və zərli nizə ilə fələk meydanından ayın gümüşü hoqqasını qovdu,

Nəzm

"Elə ki sübh dəmi bu çevik yüyənli şah (günəş),
Tutdu asimanı qılınc və nizə ilə.
Günəş qılıncından rəvan oldu,
İki yüz qan arxı asimanın kənarından.
Çalğıçı hər tərəfdən döyüş sazını çaldı,
Lərzəyə gəldi bu mavi rəngli günbəz (asiman)"[2632],

[2628] Məclis nüsxəsi: "xəyanət etdiyi iddiası ilə".
[2629] Baroda nəşri və Məclis nüsxəsi: "iyirmi beş".
[2630] Müstənsir Billah Ələvi – Misirdə hökmranlıq etmiş Fatimilər sülaləsinin xəlifəsidir və 1036-1094-cü illərdə 58 il hakimiyyətdə olmuşdur.
[2631] Sasani hökmdarı V Bəhram (420-438).
[2632] Baroda nəşrində başqa bir şeir təqdim olunmuşdur:
"Sübh çağı bu döyüş adətli şah (günəş),

döyüş və vuruş ləvazimatlarının hazırlanması ilə məşğul oldular və müntəzir dayandılar ki, qeybdən nə zahir olacaq. O zaman Sultan Heydər[2633] anasının məsləhəti ilə atasının taxtında qərar tutdu. O, nəfsani təxəyyüllər və şeytani vəsvəsələr ucbatından səltənət iddiası etdi. Gümanı bu idi ki, "Bir-birinə qovuşan iki dəniz"[2634] kimi toplanmış ustaclu qoşunu və gürcülər çarpışma zamanı ona yardımçı olacaq və canlarını onun üçün fəda edəcəklər. Ona görə də dövlətxanada olan neçə-neçə zirehi öz tərəfdarı olan qorçulara bağışlayıb, məmləkət gəlinini ələ keçirməyin intizarını çəkdi. Daha bilmirdi ki, onun səltənətinə faniliyin dörd təkbiri oxunmuşdur və onun məmləkət gəlininin üç talağı[2635] elə verilmişdir ki, bunun geriyə yolu yoxdur. İstədi ki, fırıldaq və hiylə ilə padşahlıq tacını başına qoyub hökmdarlıq taxtında otursun və yazmış olduğu saxta bir kağızı adamlara göstərdi. [Bu kağızın] məzmunu belə idi ki, dinin pənahı olan çah məni öz vəliəhdi elan etmişdir. Bəzi uzaqgörməz adamlar ona tabe olub, [İsmayıl mirzəyə qarşı] müxalif olduqlarını bildirdilər. Onlar güman edirdilər ki, zaman-zaman gümüş baldırlı gözəl saqilərin əlindən qırmızı mey camını ovcularına alacaqlar və ayaqlarını şənlik və şadyanalıq meydanına qoyacaqlar. Daha bilmirdilər ki, məclis şənləndirən gözəllərin kirpikləri ciyər deşən oxlara çevriləcəkdir, arzu-istək və əmin-amanlıq meyi misri və yəməni qılıncla əvəzlənəcəkdir, qırmızı şərabın və nar dənəsi kimiləlin yerinə onların can kanına ölüm zəhəri tökəcəklər. Amma keşikdə olan rumlu, əfşar, qacar, bayat və varsaq qorçuları dövlətxananı zəbt edib, [İsmayıl mirzənin tərəfdarı olan] əmirlərin yanına adam göndərdilər və onları hal-qəziyyədən agah etdilər.

O əsnada Heydər sultan[2636] Türkman, Əmiraslan bəy Əfşar, Məhəmmədqulu xəlifə Möhürdar, Mahmud bəy Əfşar, Söhrab xəlifə Türkmanın oğlu Süleyman bəy, Dəli Budaq Rumlu, Həsən bəy Xəzinədar Ərəbgirlü, Xanvəli bəy Baharlu çoxlu ordu və digər yüksək şanlı əmirlərlə bir-birinin ardınca Xüləfa Rumlunun[2637] yanına gəldilər. O əsnada xəbər çatdı ki, ustaclu əmirləri Sultan Heydəri [saraydan] çıxarıb səltənətə əyləşdirmək istəyirlər. Yüksək şanlı əmirlər Sultan Heydər tərəfdarlarının və onların başbiləni olan Həsən bəy Yüzbaşının oğlu Hüseyn bəyin yanına bəyan sehri ilə vəhşət düyününü hər kəsin ürəyindən açan, lətif hiylələrlə razılıq quşunu havadan aşağı endirib tora salan, yaxşı nitq qabiliyyətinə malik olan elçilər göndərib dedilər:

- Bilin ki, aləm sakinlərinin şahzadəsi İsmayıl mirzəyə münasibətdə Yaradanın lütfünün gözəlliyi və Tanrının səxavətinin qeyri-adiliyi o qədər çoxdur ki, mühit nitqinin natiqləri onu şərh edə bilməzlər və fəhmin, idrakın qüvvəsi onun keyfiyyət və kəmiyyətinə çata bilməz. Onun (İsmayıl mirzənin) nəfis vücudu asimanın tərkibi kimi eybdən qorunmuşdur və günəşin çöhrəsi kimi ləkədən arınmışdır. O həzrətin məiyyəti hansı səmtə hərəkət etmişsə, fəth və zəfər qoşunları sağdan və soldan yüyən-yüyənə ona yoldaş olmuşlar və əzəli [Allahın] qayğısı onun müzəffər bayraqlarını hər savaş meydanında yüksəltmişdir. Səadət və uğur ənqası, qalibiyyət və cah-cəlal hümayı onun kölgəsində yuva etmişdir. Qeyri-məhdud[2638] qoşunlarla və uzun bayraqlarla hansı tərəfə üz tutmuşsa, ibadət olunan həzrət (Allah) fəth qapılarını onun üzünə açmışdır. Şirvan padşahı Bürhanla, Əli paşa ilə, Əhməd paşa ilə, İsgəndər paşa ilə döyüşlər o həzrətin (İsmayıl mirzənin) bahadırlığına [dair] dörd ədalətli şahiddirlər. Bunları inkar etmək mümkün deyildir. Əgər, Allah eləməmiş, o həzrət səltənət taxtına oturmasa, qızılbaş ordusu çobansız sürüdən və yağışsız tarladan daha betər zay olacaqdır və illərdir belə bir günün arzusunda olan həsədçilər və qəsdçilər İran şəhərlərinə qəsd edəcəklər.

Onlar [isə] cəhalət və qürur üzündən dedilər:

---

Üfüqün belindən iti qılıncını sıyırdı.
Aləmdə qan tökmək üçün kəmər bağladı günəş,
Kin atəşi ilə işıqlandı onun çöhrəsi.
Ulduzlar dəstəsinin damarını söküb çıxardı,
Alovdan qaçar oldular o qığılcımlar".

[2633] Şah Təhmasibin oğulları arasında Sultan Məhəmməd Xudabəndə ən böyüyü idi. Lakin görmə qabiliyyəti baxımından əlil olduğu üçün o, həmin zaman taxta çıxa bilməmişdir. Təhmasibin ikinci oğlu İsmayıl mirzə Qəhqəhə qalasında dustaq idi. Sultan Heydər mirzə isə şahın üçüncü oğlu idi və Qəzvindəki sarayda yaşayırdı.

[2634] *Qurani-Kərim, "Rəhman" surəsi, 19-cu ayə.*

[2635] Üç talaq vermək – şəriətə görə, kişinin öz qadınını boşaması anlamına gəlir. Burada bu ifadə Sultan Heydər mirzənin hakimiyyətə gəlmək üçün şansının olmamasını bildirmək üçün məcazi mənada işlənmişdir.

[2636] Nuruosmaniyyə nüsxəsi: "bəy".

[2637] Heydər mirzəyə və ustaclulara qarşı hərəkata öncüllük edən Hüseynqulu Xüləfa Rumlu nəzərdə tutulur *(Nəvai, şərhlər, s.1500).*

[2638] Nuruosmaniyyə nüsxəsi: "məhdud".

- Bu diyardan ta Qəhqəhə qalasına qədər məsafə uzaqdlr. Sultan Heydər [isə] bəla əlamətli ordu ilə paytaxtdadır[2639]. O, gəncliyinin çiçəklənmə dövrünü yaşayan ağıllı və səadətli bir cavandır. Nisyə xəyal ilə hazır nağdı əldən vermək və xəyali mövcudluğu zahiri mövcudluqdan üstün saymaq son dərəcə ağılsızlıqdır.

Elçilər dedilər:

- [İsmayıl mirzənin] dostlarını himayə etmək qüvvəti və düşmənlərini cəzalandırmaq qüdrəti məlumdur. Əgər müxaliflik çöhrəsi düşmənçilik dırnağı ilə cırılarsa, o həzrətin qəzəb dənizinin dalğaları elə təlatümə gələr ki, əmin-amanlıq və salamatlıq gəmiləri cahanda yoxa çıxar.

Beytlər

“O, ovcunda iki şöləyə malik bir şam tutub,
Biri sübh nurudur, digəri savaş alovudur.
Sübh nuru gecəni işıqlandırar,
Lakin savaş alovu evi yandırar”.

Amma [bu nəsihətlərin] bir faydası olmadı. Çünki [Sultan Heydər tərəfdarları] mənsəb-məqam şərabından elə məst olmuşdular ki, düz yolla quyu dibini bir-birindən ayıra bilmirdilər və xeyiri şərdən, faydanı zərərdən fərqləndirməyi bacarmırdılar. Onların beyin qəsrinə qürur küləyi yol tapmışdı. Onlar aləm sakinlərinin hökmdarının (İsmayıl mirzənin) nemət və ehsan səhifələri üzərinə unutqanlıq və nankorluq xəttini çəkib, Firon kimi “Məgər Misir səltənəti, altımdan (saraylarımın altından) axıb gedən bu çaylar mənim deyilmi?!”[2640] deyərək üsyan və tüğyan təbilini döyəclədilər, yola düşdülər. Sülh və asayiş ümidi ətək kimi ayaq altına düşdü. İşi [sülhlə] yoluna qoymaq mümkün olmadı. Elçilər muradlarına və məqsədlərinə yetmədən o mərdimazar qövmün yanından qayıdıb, [İsmayıl mirzə tərəfdarı olan] əmirlərin hüzuruna gəldilər. Onlar bildilər ki, bu müşkül iş qılıncın kəsici bəyanından savayı heç nə ilə həll edilməyəcəkdir və iti xəncəri sıyırmadan bu hadisəni dəf etmək mümkün olmayacaqdır. Ona görə də döyüşə və vuruşa hazır oldular. Ordunun tərtib edilməsindən və bahadırların mükəmməl olmasından sonra dağı və səhranı bürüyən, səbanın nəfəsini qəzanın sinəsində sındıran, Yəcuc və Məcuc səflərindən daha artıq, bürclərdəki ulduzların sayından daha çox bir qoşunla dövlətxanaya tərəf yola düşdülər.

Beytlər

“Okeanın dalğalarından daha ziyadə,
Bahar fəsli yağışından daha artıq [idilər].
Ağacların yarpağı kimi saysız,
Səhranın qumu kimi hesabsız [idilər]”.

Bəziləri ilan kimi zireh geyinmiş və bir qismi balıq kimi cövşən qurşanmışdı. Hamısı əjdaha şəklində müharibə zəminində qıvrılan, səməndər kimi döyüş atəşinə bürünən, nəhəng görkəmli, çevik ahəngli, tez hərəkətli, pələngə həmtay şikar tutan və çox çalışqan, aslana bənzər davakar və döyüşkən, bəbir mislində qan tökən və tünd xasiyyətli, kərgədan kimi həmlə edən, atəş kimi coşan, fil kimi güclü, ildırım kimi yara vuran və şimşək kimi gurlayan idilər. Sarsaqoğlu Hüseyn bəy Yüzbaşı və bir dəstə şamlu qorçusu müzəffər əsgərlərdən öncə yola düşdülər. Xüləfa ilə çoxsaylı qazilər adlı-sanlı əmirlərlə ittifaqda bir dəfəyə özlərini tövlə meydanına saldılar. O meydanın səthi döyüşkən süvarilər və tüfəngçi piyadalarla dolub-daşdı. Zireh geymiş süvarilərin əlindən meydan dəmir hasara döndü və cövşənlərin ucbatından savaş məkanı sıx halqalı zirehin səthi kimi polad geyimli oldu.

Beytlər

“Oxçuların əli düyünbədüyün,
Tunc bədənlilərin kürəyi zirehbəzireh.
Məğrur süvarilər yüyənbəyüyən,
Gözəllərin kirpiyitək nizəbənizə.
Döyüş əzmi ilə igidlər kəmər bağlamış,
Dağ kimidirlər, bellərində iti qılınc var.
Yerdə tozanaq oldu, fələyi toz basdı,

---

[2639] Tehran çapında “dər payitəxt” (“paytaxtda”) əvəzinə, yanlışlıqla “dəryayi-təxt” (“taxt dənizi”?) yazılmışdır.
[2640] *Qurani-Kərim, “Zuxruf” surəsi, 51-ci ayə.*

Yer havaya qalxdı, insanlıq yerə girdi”.

Dinin pənahı olan şahın vəfat xəbəri üzüqara Hüseynə çatdıqda əbədi dövlətdə çevriliş etməyə səy göstərmək istədi. Bilmədi ki, mehtabın nuru hərzə qışqıran adamların fəryadı ilə zavala uğramaz və günəşin çırağı ovsunçuların nəfəsi ilə sönməz.

Beyt

“Bilmədi ki, günəşin o parlaq şamı,
Üfürməklə sönməz asimanın zirvəsində”.

O bədbəxt (Hüseyn bəy) qoşunun toplanmasına [dair] fərman verdi, aqibətinin ağır olacağından və nankorluğun uğursuzluq gətirəcəyindən çəkinmədi, bədkirdarlıq (yaramazlıq) ağacının səmərəsinin və cəfakarlıq (zülmkarlıq) tarlasının bəhrəsinin nə olacağını anlamadı.

Şeir

“Şadlıq məkanına başqa bir ağac əkmə,
Çünki ruzigar onun barını zəhərli edər”.

Gürcü rəisləri, Həmzə bəy Talış, Əli xan Gürcü və Zal xan Gürcü kimi bəzi şərəfsiz bədbəxtlər və bəsirətsiz uzaqgörməzlər o dövlətsizin yanına gəldilər və məşvərət etməyə başladılar. O əsnada xəbər çatdı ki, əzəmətli qazilər Sultan Heydər mirzəni dövlətxanada saxlamışlar və onun [saraydan] çıxmaq yolunu bağlamışlar. Mərdimazar Hüseyn bu xəbərdən kədərləndi, gen dünya onun gözündə “mim” (م) [hərfinin] halqasından daha da dar oldu və onun ruh quşu qartal caynağına düşmüş göyərçin kimi çırpınmağa başladı. Onun üzünü zərnix (sulfidli arsen) və zəfəran sarılığı bürüdü və damarlarındakı qan atəşdəki şirə kimi cuşa gəldi. Amma namusa riayət etmək cəhətindən öz rüxsarını ruzigarın silləsinin təsirindən qırmızı saxlayır, ixtiyar yüyənini fikirlərin və qəm-qüssənin şiddətli əlinə birdəfəlik təhvil vermirdi. Sədrəddin xan və Sultan Heydər tərəfdarları dedilər:

- Sabit düşüncəli kişi odur ki, hər küləyin əsməyi ilə sükunəti tərk edən söyüd yarpağı kimi titrəməsin və qərarında möhkəm olsun. Böyüklər demişlər:

Beyt

“Əgər istəyirsənsə huşyarlar kimi qətiyyət yolunda irəliləyəsən,
Gərək hər küləyə söyüd yarpağı kimi əsməyəsən”.

İlk [işimiz] bu olmalıdır ki, igidlik əhlindən [ibarət] bir dəstə ilə dövlətxanaya yollanaq, iti qılıncın və atəş saçan nizənin zərbəsi ilə düşmənlərin damarını qoparaq və Sultan Heydər mirzəni xilas edib səltənət taxtına əyləşdirək.

Ona görə də Sultan Mustafa mirzə və Hüseyn bəy[2641] ağır qoşunla qorçuları dəf etmək və onları qırıb-biçmək üçün parlaq qılınclarını bellərindən sıyırdılar və fitnə nişanlı nizəni sürətli atın qulağı üzərindən irəli yönəldib, hind qılıncı kimi dəmirə qərq olmuş halda “çəyirtkələr kimi”[2642] dövlətxanaya tərəf hərəkətə gəldilər.

Sultan İbrahim mirzə o əsnada Hüseyn bəyin yanına gəlib dedi:

- Dövlətə sərfəli olan odur ki, döyüş və vuruşu tərk edib öz evində sakin olasan. Çünki düşmənçilik ağacı peşmançılıq meyvəsi bitirər və münaqişə toxumu bitib-tükənmə səmərəsi yetirər.

Nəzm

“Məclisi işıqlandıran şamdır dostluq,
Evi yandıran atəşdir düşmənçilik.
Yandırma qiyamət atəşini,
Məbada bir qığılcım düşər sənə də”.

Mənim sizin yanınıza gəlməyim müsəlmanların halının asayişi üçündür. Mənim səltənətlə işim yoxdur. Səylərimin hamısı mənəvi fəzilət qazanmaq çərçivəsindədir və müsbət nəticəsi olan hadisələrin tərtibi ilə məhdudlaşmışdır.

Zahirdə belə sözlər deyirdi. Amma batində mülk (hakimiyyət) gəlininə elə məftun idi ki, onun nazqəmzəsinin tamaşasından heç cür gözünü çəkmirdi. Nifaq sahiblərinin könül arxında ixtilaf fidanı yüksəldi-

2641 Bəzi nüsxələrdə Hüseyn bəy “bədbəxt”, “mənfur” və “üzüqara” epitetləri ilə yad edilir.
2642 *Qurani-Kərim, “Qəmər” surəsi, 7-ci ayə.*

yindən onlar inad məqamından əl çəkmədilər və Sultan İbrahim mirzənin nəsihətini razılıq qulağı ilə dinləməyib yola düşdülər. O əzəli səadətsiz (Hüseyn bəy) Pəncə-Əli darvazasına çatdıqda böyük dilavərlərdən və qətiyyətli bahadırlardan bəziləri döyüşə və vuruşa başladılar və adam yıxan oxla, düşmən əzən daşla o şövkətsiz güruhu "didilmiş yun kimi"[2643] etdilər.

Nəzm

"Tüfəng də ox kimi bədəndə deşik açdı,
Can damarına minlərlə düyün vurdu.
Atəş saçan tüfəng söhbət edən xurma ağacı kimi,
İgidlərin atəşindən dərd verən əzaba düşdü.
Çıxdı ox kamandan[2644] şimşək kimi,
Qaçar oldu əjdahadan ilan oxu.
Çəkildi kaman, ox yağmağa başladı,
Ay halədən görünməz oldu.
Çərxi-fələyə qalxan tozanaqdan,
Aləmin hər yerini toz bürüdü".

Onlar can qorxusundan Dərbi-Əlaya yollandılar. O darvazanın da mühafizəçiləri müxaliflərə rəqib olub darvazanı onların üzünə açmadılar. Heydər tərəfdarları bol qüssə ilə Qaradağlılar kimi (Qaradağlılar adı ilə) məşhur olan darvazaya üz tutdular. Bədbəxt Hüseyn qapının sındırılmasını əmr etdi. Çoxlu qorçulardan və aslan ovlayan dilavərlərdən bəziləri cəsarət əlini igidlik qolçağından çıxarıb müxaliflərə ox və tüfəng atdılar. Yağış damlalarının sayı miqdarında ölüm ahəngli tüfəng mərmiləri yağmağa başladı.

Nəzm

"Pəhləvanların ürək bağında tüfəngdən qönçə açıldı,
Və o qönçədən hasil oldu dərhal ürək dağı.
Tüfənglə yanaşı nizə neyi bir-bir,
Bədənləri candan xali edirdi.
Bəla oxu döyüş kamanında,
Oturub əcəl ölüm pusqusunda.
Tüfənglər atəş qəmindən daha yandırıcı,
Paxılın ehsanından daha çox ciyər deşəndir.
Qalxana dəyən kinli oxun nəzəri,
Nişan etmişdi aşiqlərtək sinəni.
Qəm qübarı qalxdı cavanın və qocanın canından,
Axdı ox yağışının seli.
Halqa ilə doludur zülf zirehi,
Peykandan onda yüz ürək asılmış.
Sərxoş oldu qandan döyüş məstləri,
Doqquz asimanın küpü lalə rəngli meylə doldu.
O döyüş meydanının hər tərəfində yetərincə yaralı vardı,
Peykandan olub qabar oxun ayağı.
Şəfəq kimi oldu qandan asimanın kənarı,
Rüxsarına lalə rəngli pərdə bağladı günəş".

Coşqun bahadırların və dəmir donlu mübarizlərin hay-küyü Süruşun[2645] qışqırığı kimi mələikələrin huş qulağına düşdü.

Nəzm

"Amansız süvarilərin səs-küyündən,
Məhşər səhrası kimi cahana hay düşdü".

---

[2643] *Qurani-Kərim, "Qariə" surəsi, 5-ci ayə.*
[2644] Nuruosmaniyyə nüsxəsi: "Sıyrıldı qılınc beldən…"
[2645] Süruş – islamda Allaha çox yaxın olan dörd mələkdən birinin, yəni Həzrət Cəbrayılın ləqəbidir.

Ölüm ahəngli tüfəngin tüstüsündən havanın üzü ilan kimi qıvrıldı və cahan Abbasilərin paltarını və matəmlilərin libasını geyindi[2646]. Zəmanə rahiblərin yun arxalığını və brahman teyləsanını çiyninə saldı. Fələyin büllur evi qandan lalə rənginə döndü və şüşə kimi [şəffaf] günbəz (səma) həcamət[2647] şüşəsi kimi qana bələndi.

Beyt

“Gül üzlülərin libası lalə rəngli qan ilə,
Günəşin şəfəqi altlnda parlayan fələyə bənzədi”.

O hünərsiz qövm (Sultan Heydər tərəfdarları) balta zərbəsi ilə qapının təxminən bir qismini sındırdılar. Qorçular ağuşa sığmayan sütunları qapının ardına söykədilər və həmin deşikdən o azğın güruhu ox və tüfənglə yaraladılar və öldürdülər. Müxaliflər can qorxusundan mərdanə səy göstərdilər. Belə ki, illərlə təcrübəsi olan qorçular təəccüb barmağını ağızlarına qoydular.

Misra

“Yaxşı bəxt olmayan yerdə çoxlu səyin nə faydası?!”

O əsnada Xüləfa tüfəngçi və kamandar sufilərdən [ibarət] bir camaatı meydan divarı üzərindən hərəm bağçasına göndərdi ki, qorçuların köməyinə çatıb düşmənləri məhv etsinlər. Zülqədər qorçuları və digər müzəffər bahadırlar köməyə yetişdilər. O uğursuz güruh (Sultan Heydər tərəfdarları) həmin döyüş meydanında çoxlu cəhd etsələr də, öz qara bəxtlərinin təsirindən üzüqaralıqdan başqa heç nəyə nail olmayıb, məyusluq və məhrumiyyətə düçar olaraq tam biabırçılıqla digər darvazaya tələsdilər. [Lakin] onu da dövlət qapıları[2648] kimi öz üzlərinə bağlı gördülər. Əlacsızlıq üzündən süfrəxanadan özlərini dövlətxanaya saldılar. Onlardan on yeddi nəfər igidlik və cəsarətlərinin bolluğundan, cürət və çevikliklərinin çoxluğundan özlərini hərəm bağçasına saldılar və şamlu qorçularından bir nəfəri qətlə yetirdilər. Həmin vaxt tövlə meydanında olan Xüləfa, Şamxal sultan, qazilər və əmirlər özlərini hərəm bağçasına saldılar. Sultan Heydər müzəffər əsgərlərin xofundan özünü xatunların arasına saldı. Qazilər onu qadınların arasından çıxardılar. Onun müxaliflik arxında boy atmış amal fidanı əyyam hadisələrinin sərt küləyinindən yıxıldı və onun fələk zirvəsinə çatmış uğur atəşi zümrüd kimi [parlaq] qılıncın suyu ilə söndü.

Nəzm

“Fələyin baş salmaqdır peşəsi,
Çəkmək olmaz başı alın yazısından.
Axırda öldürməyəcəyi bir kəsi yetişdirməz [fələk],
Onun məhəbbəti azdır, kini böyükdür”.

Qazilər onun qürurla dolu başını bədəndən ayırıb müxaliflərin qoşununa göstərdilər. Zərurət üzündən onlar acizlik əlini fərar ətəyinə vurdular. Aləm sakinlərinin şahının (İsmayıl mirzənin) tabeçilik yolunun əksinə gedən o inad firqəsinin əksəriyyəti fil görkəmli atdan piyada olub, məğlubiyyət büsatına rüxsarlarını qoyaraq, müxtəlif fiqurların həmləsindən mat olmuş şətrənc şahı kimi çaş-baş qaldılar və dələ kimi hər tərəfə qaçıb dağılışdılar.

Nəzm

“Müxalif ordusunun hamısı pərişandır,
Gözəllərin zülfündən daha pərişandır hamısı.
Hamısı ölü, xəstə və dustaq,
Taraca, qətlə və əsirliyə giriftar.
Döyüş meydanında öldürülmüşlərin matəmini,
Əcəldən başqa bir kimsə saxlamadı.
Yetərincə can hər guşədə bərbad oldu,
Yoxluq fəzası cümlə abad oldu.

[2646] Abbasilər sülaləsinin rəmzi qara rəng idi və onlar qara geyməyi xoşlayardılar. Matəmli şəxslər də yas əlaməti olaraq qara geyərlər. Burada tüfəng tüstüsündən havanın qaralması, həmçinin tüfənglərdən qalxan tüstünün ilan kimi qıvrılması obrazlı şəkildə təsvir edilmişdir. Sonrakı cümlədə rahiblərin və brahmanların geyimlərinin xatırlanması da bu qəbildəndir.

[2647] Həcamət – ənənəvi tibdə xəstədən qan alınması əməliyyatı.

[2648] Məclis nüsxəsi: “digər qapılar”.

Torpaq [kəsilmiş] başlardan elə bəhrəmənd oldu ki,
Başını uca göylərə çatdırdı".

Uğursuzluq bəlasından zillət tozu onların səadətinin çöhrəsinə oturdu, bəxt əlindən uğursuzluq silləsi yedilər və tale kasasından zillət camı içdilər. Nəhayət, günəşin Simurq [quşu] məğribin Qaf dağı arxasında gizləndi, gündüzün ağ qartalı zülmət yuvasında nihan oldu, gecənin qara qarğası səmanın zərli yumurtasını (günəşi) öz altına çəkdi və hava günəşin fərağından matəmlilərin qarğa qanadı rəngli (qara) paltarını geydi.

Beyt

"İndi ki qır dəryası zəmindən baş qaldırdı,
Onda gündüz çeşməsi görünməz oldu".

Hüseyn bəy, Sultan Mustafanı[2649] götürdü, yıxılıb-qalxaraq Luristanın yolunu tutdu. O, bahadırların xofundan kamandan çıxan ox kimi uzaqlaşdı, səf yaran qazilərin oxunun qorxusundan qartalın həmləsindən hürkən göyərçin kimi hürkdü, cəngəllik və dərələri bağ və bostan bildi, dəvətikanının qabığını və tikanını gül və reyhan hesab elədi. Sanki kinli dilavərlərin qorxusundan o məlun bir gün içində yer üzünü qət edəcəkdi və qazilərin qılıncının xofundan döyüş meydanından ay fələyinə fərar edəcəkdi. O, can qorxusundan Sultan Mustafa mirzədən, mülazimlərindən və tərəfdarlarından ayrılıb, yun xirqə geyərək və çiyninə dərviş arxalığı salaraq yola çıxdı. Yol əsnasında Xoca Fərruxun əlində dustaq oldu.

Xüləfa və qazilər Sultan Heydər mirzənin qətlindən sonra qorxuya düşdülər. qılınc və nizə işlətmədən və can alan oxların gəliş-gedişi olmadan, "Vaxtında aradan çıxmaq lazımdır" kəlamının məzmununa uyğun surətdə zəfəri bol qənimət bilib, dəstə və toplu halında hərəm bağçasından çıxdılar. Xüləfa bəy belə qərara gəldi ki, hərəkət yüyənlərini dəyirman tərəfə çevirsinlər. Amma bəzi qorçular dedilər ki, ustaclu camaatının halının nə cür olduğunun aydınlaşması üçün bir an səbr etmək (gözləmək) lazımdır. Bu əsnada bir süvari çatıb izhar etdi ki, onlardan bu diyarda [heç kim] qalmamışdır. Ona görə də Xüləfa və Sultan Mahmud mirzə[2650] öz mənzillərinə getdilər.

Nəhayət, ayna kimi səmanın qılınc sahibi (günəş) qana aludə olmuş qılıncı qırla dolu tuluqdan çıxardı.

Şeir

"Səadət nişanlı sübhün buludu,
Bu təzə gülşəndə dürr saçar oldu.
Kin üzündən məşriq şahı hücum etdi,
Parlaq şəfəqlərini tüfəng [gülləsi] kimi saçdı.
Fələk sübhun ala atını hazırladı,
Onu elə sürətlə çapdı ki, yoluna tər töküldü[2651].
O zaman günəş şüa xətlərini zilləyərək,
Sitəm kamanı kimi çilə çəkdirdi asimana.
Lakin o sitəm kamanından yubanmadan,
Töküldü aşağı xədəng yerinə peykan"[2652].

Həmzə bəy Talış, Zal və qardaşı Fərrux ələ keçirilib qətlə yetirildilər. Əli xan Gürcü və bəzi digər bədbəxtlər qüdrətli qazilərin şiddətli qorxusundan dəlmə-deşiyə sığındılar. O rəzillərin qalanları xarab halda və pərişan vəziyyətdə hər guşədə avara oldular. Bəziləri əsir alındılar və bir qismi qılıncla oxun yemi oldular. Məhdud bir hissəsi qaçmağı qənimət bilib fərar etsələr də, çöldə və biyabanda giriftar oldular. Fəsadçıların canlı və cansız var-dövlətləri qazilərin ixtiyarına keçdi. Məmləkətin gül budağı o qorxmazların fəsadlarının tikanından təmizləndi və məmləkət çəməni ədalət gülü ilə bəzəndi. Heydər sultan Türkman, digər qazilər və mənsəb əhli dalbadal və ardıcıl surətdə Qəhqəhə qalasına yollandılar.

[2649] Sultan Mustafa – Şah Təhmasibin beşinci oğludur.
[2650] Sultan Mahmud mirzə – Şah Təhmasibin altıncı oğludur.
[2651] Bu beytdə sübh çağı yerə şeh oturması obrazlı şəkildə təsvir edilmişdir.
[2652] Xədəng – ağacqovaqdan düzəldilmiş oxdur. Peykan isə oxun dəmir ucluğudur. Müəllif günəşin şüalarını oxa bənzətsə də, bu "ox"ların xədəng oxu kimi solğun deyil, oxun dəmir ucluğu (peykan) kimi parlaq olduğunu nəzərə çatdırır.

Köhnələrin əsərlərində və yenilərin kitablarında belə bir qəribə hadisə və əcaib əhvalat rəvayət olunmayıb və yazılmayıbdır. Çünki aləmin pənahı olan şah (İsmayıl mirzə) bir neçə adamla Qəhqəhə qalasında idi, bütün qoşun isə Sultan Heydərin tərəfdarı idi, xəzinə və cəbbəxana da onun əlində idi.

Nəzm

"Bir kimsənin taleyi günəş kimi olarsa,
Aparar dövlət topunu fələyin boynundan.
Bir kimsəyə Tanrı yardım edərsə,
Xətər yetirə bilməz ona heç kim".

Elə ki dinin pənahı olan şahın [dünyadan] köçməsi xəbəri o vaxt Reydə olan Piri bəy Ustacluya çatdı, hiddət və kin üzündən Qəzvinə yollandı. Yol əsnasında qaçanlardan (Qəzvindən qaçan Sultan Heydər tərəfdarlarından) bəziləri özlərini ona yetirib qorxunc xəbərləri öldürücü zəhər kimi ona çatdırdılar. Bildi ki, Sultan Heydər mirzə zəmanənin çətin həzm edilən camından namuradlıq şərbətini içmişdir və varlıq yükünü yoxluq məkanına çəkib aparmışdır. O əclafın zatından fəryad və fəğan çıxdı. Can qorxusundan bir dəstə tərəfdarı ilə geri qayıtdı. Hiddətli aslanın və qəzəbli bəbirin həmləsindən qaçan cüyür kimi qaçırdı, [sayı] qarışqa qədər [çox olan] qoşunun xofundan ilan kimi deşik axtarırdı və gümüş üzlü (parlaq) qılıncın şövkətindən civə kimi əsirdi. O qədər iti sürətlə qaçırdı ki, kölgəsi ona çata bilmirdi.

Beyt

"Görmədən uzaqdan qılınc şimşəyini,
Tülkünün aslandan qaçdığı kimi qaçdı".

O, daş ürəkli qoşunla özünü Vəraminə saldı. Neçə əbləhlə ittifaqda küçəbənd [tərtib] etdi. O əsnada Əmir xan Türkman və Hüseyncan bəy Xınıslu elə bir qoşunla Vəraminin ətrafına gəldilər ki, [o qoşunun] şövkətindən ürək od tutub yanar, beyin başın içində kürədəki gümüş kimi əriyər və can bədəndə [qəfəsdəki] göyərçin kimi iztiraba gələr.

Beyt

"Zəmanə təbiətli, dərya kimi qorxunc, çərxi-fələk kimi bacarıqlı,
Süheyl bayraqlı, Ay çətirli və Müştəri bilikli".

Onlar həmin nadan cahilin yanına iş bacaran elçilər göndərib dedilər:

- Gərək düşmənçiliyi tərk edib aləmin pənahı olan dərgaha yollanasan.

Beytlər

"Kim ki bu qapıya gəldi niyaz üzündən,
Hər iki aləmdə başı uca oldu.
Bu astanaya hər kim alın qoyarsa,
Uğura və səadətə yoldaş olar".

Bəxtiyar padşaha qarşı müxaliflikdə israr etməyin axırı əzab və əziyyətdir. Müdriklər demişlər ki, "Hökmdarlara qarşı çıxmağın axırı təcili rüsvayçılıq və əcəldə odda yanmaqdır". Allah eləməsin, əgər müxaliflik yolunun yolçusu olsan, şəriətə və adətə qarşı çıxaraq yekdillik dibaçəsindən tabeçilik naxışını silsən, onda fərman verərik ki, okeandan (dəryayi-mühitdən) bir dalğa[2653], yəni qələbə nişanlı qoşundan bir dəstə qəhr üzündən şəhərə getsin və səni tərəfdarlarınla birlikdə xəlaiqin pənahı olan dərgaha aparsın.

Amma onun beyni sərvərlik qüruru ucbatından elə pozulmamışdı ki, öyüdün itburnu çiçəyi və nəsihətin məcunu ilə sağalsın. Dadlı sudan və halal sehrdən daha faydalı nəsihətlər onun yanında toz-torpaq və tikan kimi dəyərsiz oldu, nurdan və alovdan daha işıqlı öyüdlər onun qarşısında külək kimi vəznsiz (yüngül) və etibarsız oldu. O, cavab verdi:

- Bir halda ki mürüvvət çöhrəsi düşmənçilik əli ilə cırılmışdır, mənim bu məqamda gəlməyim çətin məsələdir.

Yenidən [onun yanına] adam göndərib xəbər verdilər ki:

- Səltənətin qərar tutduğu bu xanədanla ədavət aparmaq dağını öz əhvalının alnına çəkmiş bir camaatı hüsn-rəğbət və himayə altında tutmağın son dərəcə ağılsızlıqdır və gizli deyildir ki, həmin tayfa Həzrət

[2653] Tehran çapında "mövc" (dalğa) əvəzinə "fövc" (dəstə) yazılmışdır. Lakin nəzərə almaq lazımdır ki, okeanda dəstə olmur, dalğa olur.

Pərvərdigarın [nəzərində] rədd olunmuş və qovulmuşdur. Hadisələrin şiddətli küləyi ilə onların səadətinin təməli yerlə yeksan olmuşdur və əyyamın sərsəri küləyindən onların uğur fidanı kökündən yıxılmışdır. Dövlətə sərfəli olan iş odur ki, onları tutub bizə təslim edəsən və özün aləmin pənahı olan dərgaha yollanasan.

Onun xətalı düşüncəsinin gəmisi sındığından iztirab girdabına və yanlış fikirlər Dəcləsinə düşdü. Buna görə də itaət qapılarını cahanı fəth edən dövlətin üzünə bağladı və [təklifi] rədd etdi. O, islamın pənahı olan dərgaha yollanmayaraq iki cahanın səadətindən məhrum qaldı. Amma Məhəmməd bəy Qoyunçuoğlunu tutub əmirlərə təslim etdi. Ona görə də böyük əmirlər Bəhram [kimi] intiqamçı ordu ilə onun üstünə gəlib, iti qılınc və atəş saçan nizə zərbəsi ilə o yaramazın nəslinin və soyunun damarını qopararaq o bədbəxt qövmdən təxminən iyirmi nəfəri gedər-gəlməzə göndərdilər. Neçə nəfər digərlərini isə dustaq edib aləmin pənahı olan dərgaha yolladılar. Piri bəy balıq kimi iztirab torunda çapalayırdı. O, qazilərdən iki-üç nəfəri qətlə yetirdikdən sonra axırda qələbə nişanlı bahadırların birinin qılınc zərbəsi ilə öldürüldü. Həmçinin səfər ayının 27-də[2654] (26.05.1576) Sulaq Hüseyn Təkəlü Qəzvində Allahqulu bəy Ustaclunu qətlə yetirdi[2655].

**Aləmin pənahı olan şahın (II Şah İsmayılın) səltənət və cahandarlıq taxtına əyləşməsi haqqında söhbət**

Qadir Məlikin (Allahın) təqdir qələmi İranın, bəlkə də, cahanın səltənətini aləmin pənahı olan şahın şanlı adına yazmışdır. O, əhvalının başlanğıcında calal sahibi olan Kərimin (Allahın) hikmətinin zərurətinə uyğun olaraq, təxminən iyirmi il Qəhqəhə qalasında qalmışdır. Dinin pənahı olan şah əla cənnətə köçən vaxt Əfşar ağa bu xəbəri [ona] çatdırdı. O zaman fələyin qulamlıq etdiyi o hökmdarın (İsmayıl mirzənin) yanında tərəfdarlarından yeddi nəfərdən başqa kimsə yox idi. Bədbəxt qaracadağlılardan iyirmi beş nəfər qalada idilər. O həzrət onların hər birini bir işdən ötrü yanına çağırıb tutdu. Xüləfa ustaclu oymağını məğlub etdiyi gecə Məhəmməd bəy Ütəkoğlu Rumlunu ərizə ilə yollamışdı. Həmin məqamda o, aliəşrəf hökmdarın ayağını öpmək şərəfinə nail oldu və Xüləfanın ərizəsini təqdim etdi. Ondan sonra yenə də Xüləfanın göndərdiyi Cəlal Əli Şahverdi bəy Qorçu Çepni ərizə ilə gəlib çatdı. O həzrət, Xüləfanın və əmirlərin itaətindən çox xoşhal oldu. Onu sevənlərdən neçə nəfər qala xaricindən içəri gəlib zəfər bayrağını yüksəltdilər. Xəlifə Ənsar çoxlu qoşunla qala ətrafında məskən salmışdı və o həzrətə qarşı müxaliflik naxışını xəyal lövhəsinə çəkmişdi. O, öz nökərlərini bir-bir, iki-iki qalanın içinə göndərməyə başladı ki, orada toplaşdıqdan sonra hamısı birdən hücuma keçsinlər və o da digər bədbəxtlərlə hərəkətə gəlib qalaya daxil olsun. O həzrət bu məkrdən xəbər tutub, onları dustaq edərək bir yerdə məhbus etdi. Xəlifə Ənsar gördü ki, axirətə gedənlər kimi [qalaya] gedənlərdən də qətiyyən xəbər çıxmır, daha heç kəsi qalaya göndərmədi.

Ali mənşəli əmirlərdən Süleyman xəlifə Şamlu, Fərruxzad bəy Kəngərlü, Əhməd bəy Eşikağası və digər çoxsaylı qazilər və adlı-sanlı qorçular hər diyardan ali mənşəli hökmdarın xidmətinə gəldilər və ona mülazimlik etmək şərəfinə qovuşdular. Xəlifə Ənsar öz nəsli və soyu ilə birlikdə o çoxsaylı ordunun xofundan qorxaq-hürkək oldu. Onun bəxt gündüzü tutqunlaşdı və qaraldı, xofdan onun rüxsarı saraldı və padşahın qəzəbinin istisindən onun əzalarının dərisi nar kimi partladı. O, öz yanlış əməllərindən peşman olub, məzmunu acizlik və çarəsizlikdən ibarət olan, bağışlanmasını xahiş edən bir məktubu aləmin pənahı olan dərgaha üzrxahlıq məqsədi ilə göndərdi. [Onun elçisi İsmayıl mirzənin] nurlu düşüncəsinə ərz etdi:

- Xəlifə Ənsar indiyi kimi törətdiyi günahlara görə dövlət və səadət günəşinin nəzəri qarşısına çıxmaq taqətinə malik deyildir. Əgər hökmdarın mərhəmət və rəğbəti onun canına aman verərsə, onu şahanə xeyirxahlığından uzaqlaşdırmasın.

O həzrət ona məhəbbətamiz bir ismarış göndərdi. Xəlifə Ənsar qılınc və kəfənlə, səf yaran hökmdarın dərgahına tələsdi.

Nəzm

“Kama çatmış şahın lütfünün ümidi ilə,
Aman istəyərək gəldi qalanın içinə.
Kəfəni boynuna salmışdı,
Peşmançılıq yaşını [gözündən] tökmüşdü”.

---

[2654] Nuruosmaniyyə nüsxəsi: “26-da”.

[2655] Nuruosmaniyyə nüsxəsi: “Təkəlü qazilərindən ibarət olan bir camaat Allahqulu bəy Ustaclunu bir neçə nəfərlə birlikdə qətlə yetirdi”.

O, üzünü yalvar-yaxarla yol torpağına sürtdü və xəcalət tozu onun halının camalına oturdu. O, həmin sərvərlik səmasının günəşinin (İsmayıl mirzənin) lütf və mərhəmətinə könül verib öz xoşagəlməz hərəkətlərindən utancaq və şahanə qayğıkeşlikdən ümidvar oldu. O həzrət (İsmayıl mirzə) kəraminin və qayğıkeşliyinin çoxluğundan, rəhm və bəxşiş sandığından onun qabiliyyətli qamətinə ənam və ehsan xələti geyindirdi.

Beyt

“Şah izzət tacı ilə onun başını ucaltdı,
Ona çoxlu kərəm etdi və əzizlədi.
Yuxarıda oturanlardan daha yuxarıda oturtdu onu,
O qədər ucaltdı ki, qızıl kürsüdə oturtdu onu”.

O həzrət seşənbə günü, səfər [ayının] 22-də (21.05.1576) zəfər nişanlı əsgərlərlə qaladan çıxıb o ətrafda cah-calalla dayandı.

Nəzm

“Bir günəş boylandı cisim və can səmasından,
Onun rüxsarının ayının ziyasından nurlandı cahan.
Cahanın İsa nəfəsli sübhü ölü ürəyi diriltdi,
Elə bil, Ruhullah[2656] gəldi yerə asimandan.
Sanki Mehdiyi-Axırzaman[2657] gəldi , ya Rəbb,
Şadlıq xəzinəsi aşkar və qəm əjdahası nihan oldu”.

O əsnada Heydər sultan türkman qorçuları və[2658] bahadırlar dəstəsi ilə hökmdar ordusuna qoşulub büsatı öpmək izzətinin səadətinə nail oldu. Hər gün səhra tərəfindən bir dəstə və dərya səmtindən bir dalğa digər dəstələrin və sair dalğaların üzərinə əlavə oldu və [onların sayını] artırdı[2659]. O aləmi yandıran qoşunlar iki gün ərzində otuz minə çatdılar. O həzrət dağ görkəmli bir ata mindi.

Şeir

“Pələng şəkilli, bizon yallı, cüyür qabırğalı,
Qartal təbiətli, ənqa şövkətli və tuti tüklü.
Döyüş meydanında hava onun iki ayağından arxada qalır,
Həmlə günü səba onun iki əlindən geri qalır”.

O, cahangir günəş kimi təbii hərəkətlə şərq vilayətinə üz qoydu.

Beyt

“Qiyamət etdilər gənc və qoca ki,
Günəş oldu məşriq tərəfə rəvan”[2660].

Zəfəri elan edən bayraqlar Qəzvin şəhərinə tərəf hərəkətə gəldilər.

Nəzm

“Tələsdi o dərya şövkətli sel,
Onun yanında bir idi dərya ilə dağ.
Coşqunlar tər tökdülər tələsməkdə,
Atəş tufanından rəvan oldu su.
İzdihamla gedən nalların qığılcımından,
Sanki ulduz tökülürdü yeni aydan.
İki yüz toz dağı Sürəyyadan keçdi,
Zəminin başı uca ərşdən keçdi”.

---

[2656] Ruhulla – İsa peyğəmbərin ləqəblərindən biridir. Rəvayətə görə, İsa peyğəmbər möcüzə göstərib nəfəsi ilə ölüləri dirildərmiş. Bu misrada həmin möcüzəyə işarə olunur.

[2657] Şiə inancına görə, qeyb olmuş və qiyamət öncəsi zühur edəcəyi gözlənilən 12-ci imam Məhəmməd Mehdi Sahibüzzaman nəzərdə tutulur.

[2658] Baroda nəşri: “Heydər sultan Türkman ox və kaman qorçuları və …”

[2659] Yəni hər gün müxtəlif tərəflərdən qoşun dəstələri gələrək İsmayıl mirzəni müşayiət edən qoşunlara əlavə oldu və onların sayını artırdı.

[2660] Dini inanclara görə, qiyamət günü günəş qərbdən doğacaq və şərqə hərəkət edəcəkdir. Həsən bəy Rumlu II Şah İsmayılı günəşə bənzədir və onun şərqə doğru irəliləməsini qiyamətin qopmasına oxşadır.

Pəncşənbə günü Yaft[2661] mövqeyi əzəmətli əsgərlərin dayanacaq yeri oldu. Ordunun çoxluğundan o geniş zəminin sahəsi üzük halqasından və iynə dəliyindən daha dar oldu. Saysız qoşunların bir-birinə qarışması üzündən o böyük səhranın səthi qarışqa gözündən və ilan hədəqəsindən daha xırda nəzərə gəlirdi. Cümə günü Ərşəqdə[2662] dayandılar. Şənbə günü mübarək çətir uğurlu kölgəsini Ərdəbil şəhərinin sakinlərinin başına saldı. O, rəhmət ayəti kimi onların üzərinə nazil oldu və onun ümumi lütfü o pərişan camaata şamil oldu.

Neçə gündən sonra o, "vilayət"in pənahı, cənnət dəstgahlı, tovhid gülşəninin nəğməkarı və təcrid əncüməninin xəlvətində oturan,

Nəzm

"Tərki-dünya və təcrid xanəgahının yaraşığı,
Ədalət və tovhid bargahının əmiri.
Təriqət bostanının sərvi surəti ilə,
Həqiqət eyvanının günəşi mənası ilə",

parlaq nurların varid olduğu, xalqın halından xəbərdar, mələklər qoşununun sipəhsaları, fələk dairəsinin qütbü, yüksək zümrənin sevimlisi, aşağı təbəqənin hamisi, "vilayət" səmasının işıq saçan günəşi, hidayət fələyinin bədirlənmiş parlaq ayı,

Nəzm

"Sənin canpərvər rövzən şahlıq məskənidir,
Sənin rövzənin məşəli ilahi nurdur.
Həqq səni ruzi paylayan etdi və sən qadirsən,
Kiminkini istəsən artırarsan, kiminkini istəsən azaldarsan",

doğru şəriətin bayrağını yüksəldən, peyğəmbərlər ağasının ("Seyyidül-mürsəlin") elmlərinin varisi olan həzrətin, [yəni] Şeyx Səfiəddinin ziyarətinə yollandı.

Nəzm

"Daxil oldu o can rahatlayan rövzəyə,
Qiyaməti görmədən behiştin içinə girdi.
Asiman rütbəli, ali məqamlı [şah],
Etdi təvaf belə bir Kəbəni tamam.
Oradan çıxdı həmin nöqsansız ay,
Astananı öpməklə dodağını bəzədi".

O, haqqı çatanlara və ehtiyac sahiblərinə nəzirlər və sədəqələr paylamağa göstəriş verdi.

Beyt

"O qədər pul, mal və bərat verdi ki,
Sədəqə yeyənlərin zəkat verməsi vacib oldu".

Cümə günü, ayın 3-də (31.05.1576)[2663] ədalətli, geniş ürəkli, yüksək səxavətli, Keyvan [kimi] əzəmətli, Mərrix [kimi] şiddətli, Günəş [kimi] həmlə edən hökmdar (İsmayıl mirzə) dövlət atına minib, səadətli tale və xoşbəxtliklə uğurlu və bəxtiyar bir saatda Ərdəbildən yola düşdü.

Nəzm

"Gethaget kosundan çıxdı hay-küy,
Elə bir hay-küy ki, ondan sərsəm oldu div.
Təbilin səsindən qulaq tutdu ay,
Ordunun tozundan günəş yolunu azdı.
Atların ay kimi nallarının qığılcımları ulduza bənzər,
Yer üzü çərxi-fələkdən verdi nişan.
Bütün tuğların pərçimləri müşk saçır,
Pırtlaşıq saçlı Məcnun kimi kölgə salır".

---

[2661] Hazırda Ərdəbil vilayətinin Meşkinşəhr şəhristanının Muradlu bölgəsində bir dehistandır.
[2662] Ərşəq – Ərdəbil vilayətinin Meşkinşəhr şəhristanında bir bölgədir.
[2663] Göstərilən miladi tarix cümə gününə deyil, cümə axşamı (pəncşənbə) gününə təsadüf etmişdir.

Xaneyi-Şir kəndi müzəffər məiyyətin gəlişinin rövnəqindən İrəm gülüstanına həsəd verdi. O məqamda Kəsgər hakimi Əmirə Sasanın oğlu Əmirə Səyavuş fələk şövkətli orduya qoşuldu. Orada Sultan Mustafa mirzənin və üzüqara Hüseynin qardaşlarının Hacı Üveys bəy Bayatın mülazimləri tərəfindən tutulması xəbəri çatdı. Adı çəkilən şəxs (Hacı Üveys bəy) o xidmətinin müqabilində mükafat ("cəldu") olaraq əmirlik rütbəsinə yüksəldildi. Səhəri gün o yurddan hərəkət edib, Tutunəsrdən keçərək daha sonra dayandılar. Ertəsi gün müzəffər əsgərlər yola düşdülər. Sarıqamış çəməni izzət və calal çadırlarının düşərgəsi oldu. O məqamda Həmədan hakimi Fulad xəlifə Şamlu müzəffər əsgərlərə qoşulub böyük əmirlər cərgəsində qərar tutdu. Fələyin qulam olduğu hökmdar bir gün o məkanda qaldı. O vaxt qəzavü-qədər kimi cərəyan edən hökm verildi ki, Məntəşa sultan Ustaclunun nəvəsi Murad xan haqqı görmədiyi və batil [xəyallara] göz dikdiyi üçün onun gözlərini başının kasasından çıxarsınlar. Ona görə də onun dostu olan Pirə Məhəmməd xan Ustaclu onu kor edib Ərdəbilə göndərdi.

Həmin ayın 7-də (04.06.1576) qalibiyyətli və [Allahın] köməyini almış padşah köç etdi. Yol əsnasında Sultan İbrahim mirzə hökmdarın qoşununa qoşulub onun feyz bəş edən barmaqlarını öpməklə iftixar və baş ucalığı tapdı, qumrutək başını itaət halqasına saldı və bülbül kimi xidmətin gül budağında ötməyə başladı.

Nəzm

"[Dedi] ki, sənə candan bəndəyəm və nökərəm,
Bəxt sənin qapının torpağını mənim başımın tacı etmiş.
Sənin hüzurunda dövlətdən agah olmuşuq,
Hüzurunda gəda olmağı şahlıqdan üstün bilmişik.
Xidmət təqsirindən başımı əymişəm,
Və nə qədər ki yaşayıram, bu günahımdan utanıram.
Pislik yerinə yaxşılığı gətir irəli,
Axırda yaxşılıq görsün öz işini".

Seşənbə günü ali məqamlı hökmdar Miyanə çəmənində çadırını, alaçığını, saray pərdəsini və bargah qübbəsini günəşin və ayın zrvəsinə yüksəltdi. Pəncşənbə günündə Sərçəm[2664] ətrafı izzət və calal çadırlarının düşərgəsi oldu. Ali məiyyət dağdan və səhradan keçərək Nikpey ətrafında dayandı. Şənbə günü müzəffər əsgərlər Zəncanrudda cah-calalla dayandılar. Yol əsnasında Sulaq Hüseyn Təkəlü və Pirə Məhəmməd Ustaclu, Talış əmirləri ilə ittifaqda və İmamqulu mirzə ilə birlikdə hökmdarın qoşununa qoşuldular. Ertəsi gün Sultaniyyə şəhəri cahangirlik zirvəsinin günəşinin nurunun parıltısından asimanın bürclərinə həsəd bəxş etdi. Məsafələri qət etdikdən sonra Sayınqalanın ətrafı dəniz kimi coşan və ildırım kimi gurlayan ordunun dayanacaq yeri oldu. Elə ki Cəkcəki yaylağı yüksək səviyyəli hökmdarın məiyyətinin tozanağından iftixar bayrağını bu dövr edən günbəzdə (səmada) yüksəltdi, Qəzvinin böyükləri və əhalisi hökmdarın ordusuna qoşuldular. Çaharşənbə gününün səhərində köç edib günorta vaxtı Ağsaqüzən kənarında dayandılar. Pəncşənbə günü Qəzvin şəhərinin ətrafı hökmdarın nurunun parıltısından fələyə həsəd bəxş etdi. O həzrətin qayğıkeşlik günəşi mərhəmət bürcünün zirvəsindən əmin-amanlıq şəfəqini o diyarın əhalisi üzərinə saldı.

Nəzm

"Şükür ki, cahan şahının qədəmindən,
Qoca dünya yeni başdan cavan oldu.
Fələk əvvəldən belə bir xəyal içində idi ki,
Ona candan bəndəlik etsin.
Lakin qəzadan [bu iş] baş tutmurdu,
Bu halın surəti lövhədə əksini tapmırdı.
Axırda [fələk] etdi aşkar,
O şeyi ki, ürəyində saxlamışdı insanlardan gizli.
Çünki İlahi yardımla tutdu,
Cənnətməkan şahənşahın taxtını.

[2664] Baroda nəşri: "Pərçem".

Gəldi cülusunun tarixi qeybdən:
Taleyi qüvvətli, sahibqiran şah”[2665]

Fələyin qulamlıq etdiyi o hökmdarın qayğı və himayəsinin kölgəsində qartal göyərçinə havadarlıq üçün pərvaza gəldi və padşahın cəzasının qorxusundan fitnə Simurğu Qaf dağının arxasında tərki-dünya və guşənişinlik tənhalığına çəkildi. Aslan bayquş kimi aləmin abadlığından xarabalıqlara üz qoydu.

O həzrət cümə və camaat namazının qılınmasında, oruc və namaz hökmlərinin yerinə yetirilməsində, əmri-mərufun və nəhyi-münkərin[2666] davamlılığında, bidətlərin və haramların aradan qaldırılmasında, günahların qarşısının alınmasında və onların dəf edilməsində yədi-bəyza kimi iş görürdü. Belə ki, məmləkət işlərinin istiqaməti şəriət qaydalarının istehkamı olmadan müyəssər olmurdu. Necə ki, insanların ağasının (“seyyidül-ənam”, Məhəmməd peyğəmbər) – ona ən fəzilətli dua və salam olsun – möcüzəvi kəlamı xəbər vermişdir: “Bil ki, mülk və din birgədir”.

Beyt

“Tanrı kimə mülk (hakimiyyət) verərsə, o, dini şüar etməlidir,
Birgəliyin təfsiri bundan başqa bir şey deyildir”.

[İsmayıl mirzə], “Alimə hörmət göstərən mənə hörmət göstərər” – deyən peyğəmbərin kəlamına uyğun olaraq, müsəlman camaatın məmləkətlərinin hafizləri və Məhəmmədi şəriət yollarının gözətçiləri olan islam alimlərinə ehtiramı vacib işlərdən saydı. Çünki peyğəmbərin kəlamından göründüyü kimi, onlara hörmət göstərmək elə insanların ağasına (Məhəmməd peyğəmbərə) hörmət göstərmək kimidir. Eyni zamanda, səltənət karxanasının istiqamətini öz fədakarlıqları vasitəsilə möhkəmləndirən hərbçiləri nəzər-diqqətdə saxladı. Səxavət və bəxşiş əlini açıb, insanların nəzərində nurlu göz bəbəyi kimi dəyərli olan maliyyə vəsaitini zəfər şüarlı qoşunlara sərf etdi. Dinin pənahı olan şahın on dörd il müddətində qorçulara vermədiyi məvacibi ödədi. Belə ki, məchul bir adam yüz tümən, iki yüz tümən aldı. Cahan sakinləri Hatəmin[2667] əliaçıqlığını və Nuşirəvanın ədalətini unutqanlıq tağı üzərinə qoydular (unutdular). Müsəlman dininin bağçası Əhmədi (Məhəmməd peyğəmbərə xas) ədalətin mehlərindən günbəgün təzə-tər və şad-xürrəm oldu. Rəiyyət zülm zülmətindən [xilas olub] həyat sərçeşməsinə qovuşdu və xalq rahatlıq tapdı.

Beytlər

“Ülfət hərəmində aram tapdı heyvanlar və quşlar,
Asudə oldu ədalətin himayəsi altında insanlar və cinlər.
Fələk öz belindən qılınc kəmərini açdı,
Əyyam kamanın boynundan kirişi çıxardı”.

* * * * *

“Cəmşid ayinli, dünyanı idarə edən hökmran,
Bəzədi ədalətlə və insafla o diyarı.
Ehsana layiq bir kəsi gördükdə,
Onun qədr-qiymət başını ulu ərşə yüksəltdi.
Yetərincə pərgar oldu çərxi-fələyin oxu,
Çünki haqq tapdı öz mərkəzində qərar.
Onun dövründə dirhəmin əyarı bir başqadır,
Onu adı ilə dirhəm bir özgə cür etibara malikdir.
Onun dövründə asiman sitəmi tərk etdi,
Yer üzü yatdı əmin-amanlıq beşiyində.
Yetərincə əmin-amanlıqla aləmi abad etdi,
Kamanı kiriş bəndindən azad etdi.
Onun dövranında misri qılınc,

[2665] “Şahi-qəvi-tale sahibqiran” = 984 h.

[2666] “Əmri-məruf” (insanları yaxşı yola dəvət etmək) və “nəhyi-münkər” (insanları pis yoldan çəkindirmək) – islamın şiə cərəyanının vacib dini əməllər məcmusunun (“füruiddin”in) prinsiplərindəndirlər.

[2667] Hatəm (Hatəmi-Tai) – VI-VII əsrin əvvəllərində yaşamış ərəb qəbilələrinin başçılarından və şairlərindən biridir. O, dövrünün ən varlı və səxavətli adamı imiş. Şərq ədəbiyyatında öz səxavəti ilə məşhur olan adam rəmzi kimi işlədilir *(A.M.Babayev. Azərbaycan klassik ədəbiyyatında işlədilən adların və terminlərin şərhi, s.241).*

Yusif kimi qəm zindanında giriftar oldu.
Qidasızlıqdan qaniçən ox quşu,
Simurq kimi tirkeş Qafında əsir oldu".

O məqamda mərdimazar Hüseyni tutub aləmin pənahı olan dərgaha gətirdilər. Baxmayaraq ki, o, növbənöv qəzəb və cəzaya layiq idi, o həzrət son dərəcə yüksək xeyirxahlığı üzündən ona əziyyət etməyə meyil göstərməyib onu mülazimlərə tapşırdı. Bəzi bədbəxtlər onu o həzrətin rüxsəti olmadan qətlə yetirdilər[2668].

Nəzm

"Ey şah, yenə azdır sənə kim hər nə qədər şükr etsə,
Çünki ağılla, ədalətlə xalqı etdin asudə.
Din düşmənlərini sən elə məhv etdin ki sakitcə,
Nə əlin bulaşdı, nə də qılıncın oldu aludə".

Ona görə də qəzavü-qədər kimi cərəyan edən fərman verildi ki, say-seçmə insanlardan və avam camaatdan heç bir canlı təcavüz və intiqam qılıncını qından çıxarmasın və Sultan Heydər mirzə tabeçilərinin canına, malına və arvad-uşağına təvəqqe əlini uzatmasın. Can qorxusundan evlərdə və dəlmə-deşiklərdə gizlənmiş olan o qövmdən bəziləri[2669] özlərini aləmin pənahı olan dərgaha çatdırdılar və qiyamət əlamətli əsgərlərin təcavüzündən əmin-amanlıqda qaldılar.

Səltənət və hökmranlıq kürsüsü, səadət taxtı, cahangirlik döşəyi, məmləkət qəbası və şahlıq tacı qeyb pusqularından və "Ey mülkün sahibi olan Allah! Sən mülkü istədiyin şəxsə verərsən"[2670] xəlvətxanasından ona həvalə edildiyi üçün bu əziz xanədanın dövlət günəşinin məşriqi olan Qəzvin şəhəri cah-calal çadırının qurulduğu yerə çevrildi; haqq öz mərkəzində qərar tutdu. Qoç xəlifə Möhürdar, Qulu bəy Əfşar, Şamxal Çərkəz və Mirzə Əli bəy Qacar kimi ordu sərdarları və dərgah böyükləri çoxlu qoşunla o çəməndə müzəffər orduya gəldilər. Ondan sonra zəfər bayraqlı hökmdar Xüləfanın evinə cah-calalla qədəm qoydu. Türklər və taciklər uzaqdan və yaxından padşahın hüsn-rəğbətinin mərhəmətləri üçün cahanın pənahı olan dərgaha üz tutdular və hər biri öz rütbəsinin dərəcəsinə görə bol ənam və qiymətli ikram ilə iftixarlı və başı uca oldular. Onun günəş kimi işıq saçan düşüncəsi və Bürcis (Yupiter) təsiri bağışlayan nurlu ürəyi böyük seyidlər təbəqəsinin, islam qazıları tayfasının, məşhur elm xadimlərinin, əyyam şairləri cəminin, fəzilət və kamal sahiblərinin vəziyyətinin yaxşılaşdırılmasına meyil göstərdi. Onun ənamının feyz damcılarından bu tayfanın amal qönçəsi səadət gülzarında açdı və onun qayğıkeşlik zülalının sızmasından bu təbəqənin rifah fidanı murad çəmənində səmərə verdi. O həzrət Bəhram [kimi] qəhredici qoşunlarla şəhərə yönəldi. Dəbdəbəli tərzdə küçə və xiyabandan keçib Səadətabad bağında cah-calalla dayandı. O bağ İrəm gülüstanının bir nümunəsidir. Onun ali imarətləri fələk təbəqələri kimi görkəmlidir və onun bir küncündə həyat bəxş edən nəhrlər axmaqdadır. Həyat suyu onun zülalı qarşısında utanır və günəş çeşməsi onun bulağından xəcalət çəkir.

Şeir

"Onun zülalı yerin üzünün suyudur (abrusudur),
Onun daşan suyu yer üstünə tökülmüşdür.
Onun mehi qıvrım sünbülü şanə edib,
Havası şəbnəm yaşını danə edib".

Onun ruh bəxş edən mehindən burun ətirlənir və könül açan güllərinin tamaşasından hamının gözü nurlanır. O zaman Hacı Üveys bəy Bayat, Sultan Mustafa mirzəni tutub islamın pənahı olan dərgaha gətirdi. O, öz böyük qardaşı olan kama çatmış hökmdarın əlini öpmək şərəfinə nail olub onun hüsn-rəğbət və qayğıkeşlik baxışına tuş gəldi. O, əfv edildi və günahlarına göz yumuldu. Aləmin pənahı olan şah, "olan olub, keçən keçib" kəlamını dilə gətirdi və Sultan Mustafa mirzə digər şahzadələrin cərgəsində qərar tutdu.

O əsnada Mürtəzaqulu sultan Pornak və Şiraz hakimi Vəli sultan düşməni məhv edən bahadırlardan [ibarət] bir dəstə ilə Qəzvinə gəldilər və Fəridun kimi şan-şövkətli hökmdarın nəzəri qarşısına çıxdılar. Həm-

---

[2668] İsgəndər bəy Münşi, Hüseyn bəy Yüzbaşı Ustaclunun II Şah İsmayıl zamanı zindanda ölməsi barədə məlumatı təsdiq etsə də, onun orada öz əcəli ilə ishal xəstəliyindən vəfat etdiyini yazır *(Tarixi-aləmarayi-Abbasi, I c., Bakı, 2009, s.444).*

[2669] Baroda nəşri: "hər qövm ondan sonra".

[2670] *Qurani-Kərim, "Ali-İmran" surəsi, 26-cı ayə.*

çinin dövlət əyanları, səltənətin dayaqları, hakimlər, ərəb əşirətlərinin başçıları, nökərlər, istehkam və qalaların müstəhfizləri, səhrada yaşayanlar və b. sakinlər və ümumi məmaliki-məhrusə camaatı islamın pənahı olan dərgaha gəldilər.

O zaman əfi [ilan] surətli, əqrəb xasiyyətli, alçaq əməlli, Şümr[2671] görkəmli, kişi hesab edilən üzdəniraq nakişi, mərdimazar, din işindən qafil, həyasızlıq meydanının süvarisi [Hüseynqulu] Xüləfa Rumlu[2672] tutduğu vəzifədən uzaqlaşdırıldı. Həmin əhvalatın təfsilatı belədir ki, dinin pənahı olan şahın vəfatından və yüksək məqamlı qazilərin Qəhqəhə qalasına getməsindən sonra qüdrətli dövlətin düşmənləri Qəzvinə yanlış bir xəbər çatdırdılar. O xəsisin daimi adəti zülm və fəsad bünövrəsini təsis etmək, fitnə və inad sütunlarını möhkəmlətmək olduğu üçün öz yanında olan Rum kürdlərindən [ibarət] alçaq, ədəbsiz və yaramaz bir dəstəni topladı. Onun beyin qəsrinə pozğun xəyallar yol tapdı. Əmiraslan və bir sıra digər bədbəxtlər istədilər ki, hökmdarlıq qəbasını Sultan Süleyman mirzənin əyninə geyindirsinlər.

Beyt

“Divə çatmaz Süleymanlıq,
Ya milçəyə simurqluq”.

Bundan qafil idilər ki, heyran və sərgərdan milçəyin nə əl-ayağı var ki, əzəmət fəzasında və cah-calal havasında yüksək uçan şahbazla uça bilsin və ya dəyərsiz zərrələrin nə işığı və qüdrəti var ki, cahanın yüksək və alçaq yerlərini öz kölgəsi altında saxlayan parlaq günəşlə bərabər səviyyədə parlaya bilsin?! O zaman uğur müjdəçisi, “Biz İbrahim övladına da kitab və hikmət vermişdik və onlara böyük mülk (hökmranlıq) bəxş etmişdik”[2673] [ayəsinin] xoş ədalı nidasını xoşbəxt dövləti sevənlərin qulağına çatdırdı. Hamı sevincli, şadman, yekdil və dilbir şəkildə Həzrət Sübhana (Allaha) şükür etməklə məşğul oldular. Bu xoş xəbərin gəlişindən ruh bəxş edən meh kimi o həyəcanlı şəhər rifahlı cənnət bağçaları kimi şənləndi. Xüləfa və Əmiraslan qorxaq-hürkək oldular. O bədbəxtlərin pozğun xəyallarını xəbərçilər cahan hökmdarına ərz etdilər. Ona görə də o həzrət Xüləfanı mənsəbdən çıxarıb Damğana göndərdi və onun yerini Bolğar xəlifə Rumlunun oğlu Nurəli xəlifəyə verdi[2674], Əmiraslanı isə Şüştərə yolladı.

Ali [hökmdarın] qulağına Azərbaycanın şəriət məsələlərinin icraçılarının xəyanəti haqqında [xəbər] çatdığı üçün hamısını işdən çıxardı. Rəbiülaxır ayının son günündə (26.07.1576) Mirzə Şükrullanı vəzarət divanına təyin etdi və işlərin həllini, təşkilini, camaatın ümumi mənafeyinin yüyənini onun iqtidar ovcuna verdi. O, elə bir aydın ürəkli katibdir ki, tez gəzən ay onun yazısının sürətindən təəccüb barmağını dişinə qoymuşdur və düz tədbirli ox onun təmiz zehninin qeyrətindən təfəkkür barmağının ucunu heyrət dişində tutmuşdur. Qərara alındı ki, [Mirzə Şükrulla] cəmi əməllərdə və qadağalarda Həzrət İlahinin xofunu göz önündə saxlayıb, zalımların cəzalandırılması və məzlumların himayə olunması istiqamətində çalışaraq, heç kimə tərəfkeşlik etməsin, divanın mənfəəti yolunda və aləm sakinlərinin ərzaqla təmin olunmasının səbəbkarı olan kəndlilərin və əkinçilərin vəziyyətinin yaxşılaşdırılması uğrunda səy göstərsin.

Həmçinin bu zaman müstövfilik mənsəbi İsfahanın yüksək dərəcəli seyidlərindən olan Şah Qaziyə həvalə edildi.

Həmçinin çaharşənbə günü, cəmadiyüləvvəl [ayının] 27-də (22.08.1576) aləmin pənahı olan şah Çehelsütun eyvanındakı hökmdar dövlətxanasında şərəfli tale və bəxtlə səltənət taxtı üzərində əyləşdi. Həzrət əmirləri, dövlət ərkanı, dünyanın pənahı olan dərgahın məhrəmləri, Kəbəyə bənzər astananın mülazimləri, rütbə yiyələri, mənsəb sahibləri, ali rəyli alimlər və bacarıqlı vəzirlər münasib yerlərdə qərar tutdular. Məclisin önündə bir dəstə hacib ay və günəş kimi dayanmışdı. Onların əlləri qılıncın qəbzəsində və qulaqları şəklənmiş vəziyyətdə [idi].

Şeir

---

[2671] Şümr – İmam Hüseynin qatilidir.

[2672] Maraqlıdır ki, müəllif Həsən bəy Rumlu özü ilə eyni tayfaya mənsub olan və əsərinin əvvəlki yerlərində tərifədiyi dostu Hüseynqulu Xüləfa şahın gözündən düşüb vəzifədən kənarlaşdırıldıqdan sonra onun haqqında son dərəcə təhqiramiz ifadələr işlətməyi rəva görmüşdür.

[2673] *Qurani-Kərim, “Nisa” surəsi, 54-cü ayə.*

[2674] İsgəndər bəy Münşiyə görə, II Şah İsmayıl zamanında Bolğar xəlifə Rumlunun oğlu deyil, özü xəlifətül-xüləfa mənsəbini daşıyırdı *(Tarixi-aləmarayi-Abbasi, I c., Bakı, 2009, s.432).* “Əhsənüt-təvarix”in Ç.N.Seddon nəşrində də xəlifətül-xüləfa vəzifəsinə Bolğar xəlifənin təyin edildiyi göstərilmişdir *(Baroda nəşri, vol. II, p.206).*

“Xidmətdə pəri görkəmlilər şah önündə,
Kəmər bağlamışlar halədən ay kimi.
O bargahdakı yaraşıqlıların çoxluğundan,
Yer üzü günəş və ayla dolu bir asimana döndü”.

Xarəzm valisi Hacım xan Özbəyin oğlu Məhəmmədqulu sultanı, Din Məhəmməd oğlu Əbülxanın elçilərini, Portuqal [adı] ilə məşhur olan Firəng padşahı Dan Sebastiyanın elçilərini, Gürcüstan hakimləri Ləvənd oğlu İsa xanı, Ləvasan oğlu Simaun bəyi və Luristan hakimi Şah Rüstəmi bargaha gətirdilər. Onlar itaət şərtlərini yerinə yetirdilər və bəzənmiş bir behişt gördülər ki, orada qızıl və gümüş tabaqlar düzülmüş, ipək xalılar sərilmişdi. Aləmin pənahı olan şah məhəbbətli kəlmələrin və dostcasına sözlərin sığalı ilə onların könül güzgüsündən qəm pasını təmizlədi və yemək məclisinin bitməsindən sonra izzət və ehtiramla öz mənzilinə qayıtdı.

Dinin pənahı olan şah zamanında elçi sifəti ilə Ruma getmiş və Sultan Murad tərəfindən pəri üzlü qulamlardan, zərli işləməli alaçıqlardan, ərəb atlarından, Şam və Hicazın yeyin atlarından, dördkünc çadırdan, Şüştər ipəyindən [toxunmuş] bargahdan, gümüş və qızıl sandıqlardan, nəfis kitablardan və dəyərli qumaşlardan [ibarət] bol hədiyyələrə və qeyri-məhdud töhfələrə layiq görülmüş Şahqulu sultan Ustaclunun oğlu Toxmaq sultan şənbə günü Sultan Muradın çavuşu ilə birlikdə aləmin pənahı olan dərgaha gəldi və əmirlərin vasitəçiliyi ilə əlahəzrətin ayağını öpmək şərəfinə nail oldu. O, [Sultan Muradın göndərdiyi] məhəbbət və sevgi izharından, dostluq və ittihad qaydalarının möhkəmləndirilməsindən bəhs edən məktubu [II Şah İsmayıla] təqdim etdi.

O zaman dəlilik nəşəsindən tam nəsibini almış Peykər bəy Qacar gözlənilmədən hamamda Gəncə hakimi Yusif xəlifə Ziyadoğlunun üzərinə gedib o biçarəni qətlə yetirdi və bununla kifayətlənməyib onun anasını da gedər-gəlməzə göndərdi. Bu xəbər alicənab şaha çatdıqda, dünyanı bəzəyən düşüncəsinə çox ağır gəldi və onun həbsi haqqında hökmdar fərmanı verildi. Onu sərçə kimi bəla qəfəsində əsir və əzab tələsində dustaq etdi və o, göyərçin kimi iztirab toruna düşdü.

Seşənbə günü, şaban ayının 7-də (30.10.1576) Sultan Süleyman mirzə və Sultan Mustafa mirzə hərəkət bayrağını axirət aləminə yüksəltdilər (öldülər). O əsnada Qəhdəhardan bir qasid gəlib bəyan etdi ki, Bəhram mirzənin oğlu Sultan Hüseyn mirzə varlıq nağdını Qabizül-ərvaha (Əzrailə) vermişdir. Aləmin pənahı olan şah onun oğlu Məhəmməd Hüseyn mirzənin mənzilinə tələsib [xətrini-əhvalını] soruşdu (başsağlığı verdi) və Qəndəhar hakimliyini Fulad xəlifə Şamluya həvalə etdi.

Həmçinin eyni vaxtda Qoç xəlifə Möhürdar Zülqədər mənsəbdən azad edildi. Aləmin pənahı olan şah ali möhürü Bəhram mirzənin oğlu Sultan İbrahim mirzəyə tapşırdı. O əsnada Lar valisi İbrahim xanın elçiləri öz diyarlarından ali mənşəli hökmdarın bargahına gəlib peşkəş qaydasında nağddan (puldan), cavahirdən, külək rəftarlı ərəb atlarından və zərnigar taclardan [ibarət] çoxlu mallar təqdim etdilər.

Nəzm

“Div soylular pəri surətində,
Quruda və dənizdə cövlan etməkdə.
Səhra şahidi ev tələbi ilə,
Bağlayıb zəncir divanəlikdən.
Çevik və rəqsan halda gəldilər dəstə-dəstə,
Səmadakı göyərçin kimi müxtəlif, əlvan”.

Həmçinin Mazandaran valisi Sultan Məhəmməd xan ibn Sultan Murad xanın elçisi bol peşkəşlər təqdim etdi. Eləcə də Rəşt hakimi Cəmşid xanın elçisi və Hüveyzə valisi Seyid Səccadın qasidi Qəzvinə gəldilər, Çehelsütun eyvanında Lar elçisi ilə birlikdə yeri öpmək şərəfinə nail oldular və öz hakimlərinin dilindən itaət izhar etdilər.

Çaharşənbə günü, şaban ayının 27-də (19.11.1576)[2675] rəhmətlik şahın (Təhmasibin) hərəm bağında əmanət şəklində dəfn olunmuş nəşini (meyitini) cinlərin və insanların imamı Sultan Əli ibn Musa ər-Rzanın (İmam Rzanın) civarında dəfn etmək niyyəti ilə çıxardılar. Aləmin pənahı olan şah növhəni və ah-zarı tutqun

[2675] Göstərilən miladi tarix çərşənbə (çaharşənbə) gününə deyil, bazar ertəsi (düşənbə) gününə təsadüf etmişdir.

səmaya çatdırdı. Onun şərəfli cəsədini şahzadə Hüseyn [məqbərəsində] qoydular. O həzrət böyük həcmdə aş bişirilməsinə fərman verdi və öz nəfis vücudu ilə şəhər xaricində tərtib edilmiş bargaha təşrif gətirdi. Aləmin pənahı olan şah səhərdən axşamacan ayaq üstündə dayandı və xidmət göstərdi. Xansalarlar (süfrəçilər) ləziz yeməkləri həddən artıq və xəyal mədəsinə yığıla biləndən daha çox [miqdarda] gətirdilər.

Nəzm

“Hər yerdə elə süfrələr açdılar ki,
Sanki günəş içinə süfrə payəsi qoydular.
Rəngarəng süfrənin bolluğundan,
Geniş cahan dar oldu.
Bu doqquz asimanın tabağı,
Orada duzqabı kimi görünürdü”.

Xalqın müxtəlif təbəqələri o faydalı süfrədən bol həzz və yetərincə nəsiblə ləzzət alıb bəhrə götürdülər.

O əsnada Sulaq Hüseyn Təkəlü ilə Mürtəzaqulu sultan Türkman arasında bir döyüş baş verdi. Bu ədəbsizlik səbəbindən əcəmin və ərəbin padşahını (yəni ərəblərin və qeyri-ərəblərin padşahını) tər bürüdü. O, öz gözəl yerişli atına minib o dava iştirakçılarından üç nəfəri oxla vurdu. Ona görə də fitnə atəşi yatdı. Fələyin qulamlıq etdiyi şah yeməyin yeyilməsindən, calal və ikram sahibinin (Allahın) kəlamının (“Quran”ın) xətmindən sonra dövlətxanaya yollandı.

Ramazanın (22.11-21.12.1576) axırında Xorasandan xəbər gəldi ki, Xorasan əmirülümərası olan Şahqulu sultan Ustaclunu qətlə yetirmişlər. Onun öldürülməsinin səbəbi odur ki, o, dikbaşlıq və azğınlıq iddiasına malik idi. Cənnət nişanlı Herat şəhərində olan Hüseyn sultan Əfşar, Xosrov sultan Koroğlu, Əmir Həsən Xətib və b. qazilər bir yerdə oturub məşvərət etdilər və dedilər:

- Aləmin pənahı olan şaha müxaliflik etmək məhz cəhalət və yaramazlıqdır. Çünki qara bəxtinin bələdçiliyi ilə o həzrətə qarşı müxaliflik və düşmənçilik bayrağı qaldırmış hər kəsin iş-gücünün səhifələri üzərinə ruzigar başıaşağılıq və fəlakət hərfini yazmışdır. Şahqulu sultan haqtanımaz və vəfasız adamdır. O, dinin pənahı olan şahın ona göstərdiyi qayğıkeşlik hüququnun dəftərini unutqanlıq tağı üzərinə qoymuşdur, müxaliflik və üsyan yolu ilə getməkdədir. Fürsəti əldən verməK lazım deyildir. Xatirimizi onun əqidəsinin xəbisliyindən və hiyləgərliyinin murdarlığından pak etmək gərəkdir və belə bir qorxmaz şəxsin yoxluğunu açıq-aşkar şadmanlıq müjdəsi və iki cahanın[2676] sevincinə nail olmağın sərmayəsi hesab etmək lazımdır.

Ona görə də müsəlləh və mükəmməl olub onun evinin qapısına getdilər. Onun mülazimləri qılınc işlətməyərək, tülkü kimi qaçmağa üz qoydular. Qazilər onun canını bədənindən çıxardılar və onun həmin şəhərdə həyəcana gələn fitnə-fəsad tozunu atəş saçan qılıncın suyu ilə yatırdılar. Bu sevincli xəbərin çatdırılması üçün ildırım və külək kimi [tez gedən] bir qasidi Qəzvinə göndərdilər. Bu xəbər alicənab şahın qulağına çatdıqda dəyərli Herat şəhərinin hakimliyini Şirvan valisi Araz sultan Rumluya tapşırdı.

Dəfələrlə əhvalının səhifəsindən vəfasızlıq və nifaq əlamətləri zahir və aşkar olmuş Hüseynqulu Xüləfa həmin zaman kor edildi.

Həmçinin eyni zamanda Sultan Heydər mirzə tərəfdarları silkində qərar tutmuş Seyid bəy Kəmunə dustaqlıq və həbs möhnətinə giriftar oldu.

Yekşənbə günü, zilhiccə [ayının] 6-da (24.02.1577) Bolğar xəlifənin oğlu Nurəli xəlifə həbs edildi. Aləmin pənahı olan şah onu yasavulluqdan və həqarətdən əmirlik mənsəbinə ucaltmışdı. O, cəhalət səbəbindən güman edirdi ki, fələk onun rüxsəti olmadan dövr edə bilməz və külək onun izni olmadan hava meydanında cərəyan edə bilməz. O, elə hərəkətlərə təşəbbüs göstərdi ki, əlahəzrət hökmdarın xoşuna gəlmədi.

Elə həmin gün tale qələmi Sultan Mahmud mirzənin, Sultan Əhməd mirzənin və Məhəmməd Hüseyn mirzə ibn [Sultan Hüseyn mirzə ibn] Bəhram mirzənin vücudunun naxışını varlıq lövhəsindən sildi. Bu hadisə ilə eyni zamanda hüsn-rəğbətə və lütfkarlığa layiq görülmüş Bəhram mirzənin oğlu Sultan İbrahim mirzə dəfələrlə vəfasızlıq və hiyləgərlik törətdiyi üçün öz əməllərinin cəzasına giriftar oldu və qəzavü-qədər əli onun həyatının sicillini yazdı.

[2676] Baroda nəşri: “həyatın”.

Yenə həmin gün sufilərin qətli haqqında qəzavü-qədər kimi cərəyan edən fərman verildi. Səbəbi odur ki, Diyarbəkr kürdlərindən [ibarət] bir camaat dəstə-dəstə Qəzvin şəhərinə gəlmişdilər və şəhər kənarında məskən salmış, öz çoxluqları səbəbindən məğrur olmuşdular. Dinin pənahı olan şahın zamanında ziyansız olduqları üçün onlara qarşı tədbir görülməmişdi. Bu gün o qaragün güruh bazar daruğasını vurdu. Xəbərçilər cahan padşahına ərz etdilər:

- Onlar ayaqlarını itaət dairəsindən və boyunlarını tabeçilik boyunduruğundan çıxarmışlar və əyinlərinə üsyan və tüğyan libası geymişlər. Onların qırılıb-biçilməsi qeyrət yönündə vacib olan məsələlərdən və səltənət yolunda mühüm olan işlərdəndir.

Ona görə də qəzavü-qədər kimi cərəyan edən bir fərman verildi ki, Məhəmməd xan Təkəlünün oğlu Müseyib xan və Mürtəzaqulu sultan Pornak qorxmaz dilavərlərdən [ibarət] bir dəstə ilə o murdar ("napak") qövmü dəf etməyə getsinlər. Yüksək şanlı əmirlərin mülazimləri onlara qılınc vurdular və yəmani qılınc (Yəmən qılıncı) baş səpələməyə başladı. Əcəl dəllalı kiçiyi və böyüyü, cavanı və qocanı bir nırxa satırdı. Qəzəb alovunda varlı və yoxsul təfavütsüz yanırdı. O bədbəxt güruhdan təqribən beş yüz nəfər qətlə yetirildi. Qazilər [onların] bir dəstəsini dustaq edib islamın pənahı olan dərgaha gətirdilər. Aləmin pənahı olan şahın qəzəb surəti təskinlik tapdıqdan sonra onların qalanlarına rəhm edib hökm verdi ki, daha heç kəs onlara dəyib-dolaşmasın.

O zaman möhürdarlıq mənsəbi bəyənilən xüsusiyyətləri və gözəl çalışqanlığı qaranlıqda ay kimi və gündüz çağı günəş kimi görünən, kübarlığa və ad-sana malik olan Şamxal sultana həvalə edildi. Seşənbə günü, zilhiccə ayının 15-də (05.03.1577) Şəbankərə[2677] hakimi Şahəli xəlifə Zülqədər Qəzvinə gəldi. Ertəsi gün Kuhi-Giluyə valisi Xəlil xan Əfşar ali dərəcəli şaha itaət halqasını qulağına taxıb, niyaz üzünü uğurun məskən saldığı astanaya çevirərək Çehelsütun eyvanında büsatı öpmək şərəfinə nail oldu və başını bəndəlik xətti daxilinə, qədəmini tabeçilik dairəsi içinə qoyub təqribən iki min tümən nağd [pul] və cins [mal] peşkəş etdi. Hər gün bir dəstə [gəlib] səadətli çətirin kölgəsinə sığınırdı və hər zaman bir çox adam ali astanaya üz tutub gəlirdi.

### Ölümlər

Şah Təhmasib ibn Şah İsmayıl ibn Sultan Heydər ibn Şeyx Cüneyd ibn Şeyx İbrahim ibn Sultan Xoca Əli ibn Şeyx Sədrəddin Musa ibn Sultan Şeyx Səfi ibn Seyid Cəbrayıl ibn Şeyx Saleh ibn Şeyx Qütbəddin ibn Şeyx Səlahəddin Rəşid ibn Məhəmməd əl-Hafiz ibn Əvəz əl-Xəvas ibn Firuzşah ibn Seyid Şərəfşah ibn Seyid Məhəmməd ibn Həsən ibn Seyid Məhəmməd ibn Seyid İbrahim ibn Seyid Cəfər ibn Seyid Məhəmməd ibn Seyid İsmayıl ibn Seyid Əhməd ibn Seyid Məhəmməd Ərabi ibn Seyid Əbu-Məhəmməd Qasım ibn Əbülqasım [Həmzə ibn İmam Musa əl-Kazım] bu il əbədiyyət aləminə yollandı[2678]. Necə ki, [yuxarıda] zikr

---

[2677] Şəbankərə – İranın Fars vilayətinin bir bölgəsi olub Şirazdan şərqdə yerləşir. Niriz şəhəri Şəbankərə bölgəsinə daxildir *(Seddon, şərhlər, s.294)*.

[2678] Ç.N.Seddon nəşrində bu şəcərənin yerinə nəzmlə başqa bir şəcərə verilmişdir. Həmin şəcərənin Firuzşahdan İmam Musa əl-Kazıma qədərki hissəsində fərqlər nəzərə çarpır:

"Aləmin pənahı olan Şah İsmayıl, Əzəmət və şan-şöhrət sahibi.
Atası Şah Heydər ibn Cüneyd, İlahi dərgahın qütbü idi şübhəsiz.
Onun atası Şah İbrahimdir, Vüsal Kəbəsinin qapısında sakin.
Onun da atası Şah Əli idi, Aydın günəş kimi bir könül aynası vardı.
Sonra zamanın şahı Sədrəddin, Şəriət taxtının imamı və qoruyucusu.
Onun atası saf nəfəsli Səfi, Ürəyi qeyb sirrinə məhrəm idi.
Onun atası Şah Cəbrayıl Əmin, Babası isə dövrün qütbü Qütbəddin.
Saleh ibn Məhəmməd ibn Əvəz, Bir də əvəzi olmayan Şah Firuz.
Sonra Mehdi ibn Əli Həsən, Ardınca zamanın övliyası Əbülqasım.
Sabit ibn Hüseyn ibn Əhməd, Sonra Davud ibn Əli gəlir.
Musayi-Sani ibn İbrahim, Təmiz qəlbli könül Turunun sahibi.
Onun atası din imamı Kazim, Şəriətin şərəfi onunla yüksəldi.
Onun atasıdır Cəfər əs-Sadiq, Sübh onun günəşinin nurundan ucalır (doğur).
Onun atası Məhəmməd Bağır, Allahın elm xəzinəsinin fəxri.
Onun atası pak soylu imam, Əli ibn Hüseyn Zeynalibad.
Bu həmin Hüseyn ki, atası Əli, Həmin Əli ki, Allahın vəlisi.
Mustafanın varisi və Zəhranın əri, Peyğəmbərin həqiqi canişini.
Allahın aslanı və səf yaran qəhrəman, Şahi-Mərdan Əli ibn Əbu-Talib.

olunmuşdur. Onun məmləkəti [ibarət idi]: Azərbaycan, Şirvanla Şəki, Arran, İraqi-Əcəm, Fars, Kirman, Xorasan, Gilandan Biye-Pəs.

O həzrətin gəncliyinin əvvəlində xətt yazmağa və naqqaşlığa böyük həvəsi vardı. Ondan başqa, Misir eşşəklərinə minirdi və eyni zamanda nizə oynatmaqla məşğul olurdu. Ona görə də eşşəkləri qızıl yəhərlər və zərbafta yüyənlərlə bəzəyirdi. O səbəbdən Buqüleşq bu beyti demişdir:

"Nə gözəl tərəqqi etdilər bi-şəkk,
Katib, naqqaş, qəzvinli, bir də eşşək"[2679].

Kamillik əyyamında isə səhərdən axşama kimi dəftəri qarşısına qoyub mülk (dövlət) işləri ilə məşğul olurdu və işlərin xırdalıqlarının hamısına şəxsən özü nəzarət edirdi. Belə ki, vəkillər və vəzirlər o həzrətdən izinsiz kimsəyə bir fəls (xırda mis pul)[2680] belə verə bilməzdilər.

O həzrətin qaydası belə idi ki, bir gün dırnağını tutardı, digər bir gün isə səhərdən axşamacan hamamda olardı. Əksər əşyanı nəcis bilrədi, özünün yarımçıq yeməyini suya və oda atardı, məclislərdə yemək yeməzdi və şərab içməmək qaydasına böyük bir ifratla riayət edərdi. Təqribən beş yüz tümənlik saf tiryəki suda məhv etdirmişdi, cəmi ləzzətləri tərk etmişdi və təxminən iyirmi il [ata] minməmişdi. Əsərlərindən (quruculuq işlərindən): Tehrandakı qala divarı; İmam Rzanın müqəddəs Məşhədinin qala divarı; Qəzvin şəhərində yerləşən dövlətxana; həmçinin bu şəhərdə əla hamamlar[2681] tikdirmişdir; Təbriz şəhərində yerləşən bir məscid; Zəncanla Sultaniyyə arasında bir ribat bina etmişdir. Onun görkəmi uca boylu, uzunsov üzlü, əlləri uzun, çöhrəsi sarı və saqqalı tamam ağ idi. O həzrətin əyyamında rəiyyətin rifahı nəhayət dərəcəsinə çatmışdı. O həzrət əksər zamanlarda ölkəyə daruğa göndərməzdi. Ona görə də hər gün avam camaat[2682] arasında dava-dalaş olurdu. Qızılbaş qoşunu ona o qədər etiqad bəsləyirdi ki, on dörd il onlara məvacib verməsə də, heç kəs şikayət etmirdi və cidd-cəhdlə xidmət göstərirdilər. Onun əvəzini aləmin adil padşahı, zamanın İsgəndəri, dövranın Hatəmi, müdriklərin sultanı və alimlərin bürhanı,

Beytlər

"Elm və əməldə zəmanənin öndəri,
Hikmət fənləri sərvərlərinin başçısı.
Müşkülləri hikmət ilə çözən,
Səmavi elmlərdə dəqiq nəzər sahibi olan",

ali məqamlı şah Sultan Məhəmməd Xudabəndə çıxaraq ordunun on dörd illik məvacibini birdəfəyə ödədi. Belə ki, məchul bir adam xəzinədən iki yüz tümən, üç yüz tümən [alıb] öz mənzilinə apardı.

O həzrət (Şah Təhmasib) səltənəti əyyamında iki döyüş etmişdir: birinci döyüş ustaclu əmirləri ilə Səksəncəkdə[2683], ikinci döyüş Übeyd xan və b. özbək sultanları ilə Cam çayında.

Oğlan övladları:

Birincisi: Aləmin və aləm sakinlərinin padşahı Sultan Məhəmməd Xudabəndə.

İkincisi: [II] Şah İsmayıl cənabları.

Üçüncüsü: Sultan Murad mirzədir ki, dinin pənahı olan şah onu Hümayun padşahla birgə Qəndəhara göndərmişdi və həmin şəhərdə kiçik yaşlarında dünyadan köçdü.

Dördüncüsü: Sultan Süleyman mirzədir ki, dinin pənahı olan şah onu İmam Rzanın müqəddəs Məşhədinə mütəvəlli[2684] [təyin] etmişdi. Bu il Qəzvin şəhərində o, [II] Şah İsmayılın fərmanı ilə qətlə yetirildi.

Beşincisi: Sultan Heydər mirzə. Şahın vəkili Məsum bəy Səfəvi dinin pənahı olan şah tərəfindən onun lələsi [təyin] edilmişdi. Dinin pənahı olan şahın ölümündən sonra səltənət iddiası edib o qovğada öldürüldü. Necə ki, [yuxarıda] zikr edilmişdir.

Altıncısı: Sultan Mustafa mirzə. O da bu il [II] Şah İsmayılın fərmanı ilə öldürüldü.

---

Dinin pənahı olan şahın nəsəbi budur, Şahı yaxşı tanıyıb bil ki, şah budur!"

[2679] Buqüleşq XVI əsr şairlərindəndir. Bu beytdə Şah Təhmasibin xəttatlığa və naqqaşlığa olan həvəsinə, katib və naqqaşları himayə etməsinə, asudə vaxtlarında eşşək minməyi xoşlamasına və qəzvinli vəzir Qazı Cahanı yüksəltməsinə işarə edilmişdir (bax: *О.А.Эфендиев. Азербайджанское государство Сефевидов, с.115-116*).

[2680] Nuruosmaniyyə nüsxəsi: "yarım dinar".

[2681] London nüsxəsi: "əla hamamlar və çarşı".

[2682] Baroda nəşri: "Azərbaycan rəiyyəti".

[2683] Nuruosmaniyyə nüsxəsi: "Səksəkcük".

[2684] Baroda nəşri: "İmam Rza həzrətlərinə xadimbaşı".

Yeddincisi: Sultan Mahmud mirzə. Dinin pənahı olan şah Şirvan hakimliyini ona həvalə etmişdi. Bu il Qəzvində [II] Şah İsmayılın fərmanı ilə qətlə yetirildi.

Səkkizincisi: İmamqulu mirzə. Dinin pənahı olan şah tərəfindən Lahican hakimi idi. Bu il o da hərəkət bayrağını axirət səmtinə yüksəltdi.

Doqquzuncusu: Sultan Əli mirzə. Dinin pənahı olan şah tərəfindən Gəncə hakimi idi. Bu il [II] Şah İsmayılın fərmanı ilə kor edildi[2685].

Onuncusu: Sultan Əhməd mirzə. Bu il o da varlıq paltarını ölüm küləyinə verdi.

On birincisi: Zeynalabidin mirzə kiçik yaşında, atasının sağlığında Qəzvin şəhərində əbədiyyət aləminə yollandı.

On ikincisi: Musa mirzə. O da kiçik yaşında Qəzvin şəhərində atasının zamanında vəfat etdi.

Qız övladları:

Birincisi: Pərixan xanım. Sultan Süleyman mirzənin bacısıdır[2686].

Digəri: Fatimə-sultan xanım. Sultan Mahmud mirzənin bacısıdır.

Digəri: Xanış xanım. İsmayıl mirzənin bacısıdır.

Digəri: Gövhər-sultan xanım. Sultan İbrahim mirzənin zövcəsidir.

Digəri: Məryəm xanım.

Digəri: Anaxanımdır ki, Herat hakimi Əliqulu xana verdilər.

Digəri: Şəhrəbanu xanımdır ki, Müseyib xan Təkəlüyə nişanlanmışdı.

Digəri: Xədicə-sultan xanımdır ki, Cəmşid xana verdilər.

Həmçinin bu il, düşənbə gecəsi, zilqədə [ayının] 9-da (28.01.1577) böyük mövlana, fəzilət və hikmət sahibi, incəliklərin müşküllərini həll edən və həqiqətlərin çətinliklərini kəşf edən Əmir Fəxrəddin Simaki yer üzünü öz vücudundan xali və boş qoydu. O, bəşər ustadı Əmir Qiyasəddin Mənsur Şirazinin tələbələri cümləsindən idi. Onun mübarək qələminin məhsulu [olan əsərlər] sırasında bunlar vardır: "Haşiyə bər ilahiyyat" ("İlahiyyata dair haşiyə") və "Şərhi-təcrid" ("Təcrid şərhi").

### 985-Cİ İLDƏ (21.03.1577 – 09.03.1578) BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA SÖHBƏT

Bu il Şirvan camaatı müxaliflik etməyə başladı. Bürhanın bacısı oğlu Kavus mirzəni padşahlığa[2687] əyləşdirdilər, öndərlik və rəislik qəbasını onun boyuna biçdilər, ordunun idarəçiliyini onun ixtiyarının ovcuna verdilər. O, tam intizamlı və dəbdəbəli bir şəkildə, xəyalların idrakından kənar bir lovğalıq və qürur ilə Şabrana üz qoydu. O diyarın valisi Araz sultan Rumlu altı yüz nəfər bahadırı o əbləhləri dəf etmək üçün təyin etdi. Qazilər gözlənilməz bəla kimi Şabranın iki fərsəxliyində müxaliflərə çatdılar. Mirzə Kavus hər biri "mənəm və başqası yoxdur" deyə iddia edən tərəfdarlarından [ibarət] bir dəstə ilə həmlə etdi. Qazilər, "Neçə dəfə olub ki, az bir dəstə Allahın izni (iradəsi) ilə çox bir dəstəyə qalib gəlib!"[2688] ayəsinə etimad edib özlərini müxaliflərin mərkəzinə vurdular. Onlar müqavimət taqəti və mətanət qüdrəti göstərə bilməyib, "Qarşısında dayanılmayan şeylərdən qaçmaq peyğəmbərlərin ənənəsidir" adətinə əməl edərək qaçışa üz qoydular. Məyus və binamus Mirzə Kavus fərar vadisinə tələsdi. Qazilər o hünərsiz qövmdən dörd yüz nəfəri qətlə yetirdilər və onların namübarək başlarını islamın pənahı olan dərgaha göndərdilər.

Çaharşənbə günü, rəbiüləvvəl [ayının] 26-da (13.06.1577)[2689] Mirzə Şükrulla vəzirlikdən çıxarıldı. Aləmin pənahı olan şah ali divan mənsəbini və vəzirliyi aydın ürəkli, bacarıqlı, müdrik və tədbirli bir vəzir olan, ağıl və bəsirət nurlarını təcəlli etdirən, işlərin öhdəsindən gələn və etiqad gözəlliyi ilə bəzənmiş Mirzə Salmana həvalə etdi. İşlərin həlli və təşkili onun iqtidar əlinə verildi. Məmləkətin saxlanması, yolların müha-

---

[2685] Ç.N.Seddonun çapında "İsmayıl mirzənin fərmanı ilə ölüm şərbətini içdi" yazılsa da, bu, doğru deyildir. Çünki İsgəndər bəy Münşi bu şahzadənin kor edildiyindən, lakin sağ qaldığından bəhs etmişdir. Buna görə də biz, Ə.Nəvainin nəşrindəki versiyanı (şahzadənin kor edilməsi versiyasını) əsas aldıq.

[2686] Siyasi həyatda fəal iştirak edən bu qadının həyat yolu və fəaliyyəti haqqında bax: *Ş.F.Fərzəliyev. Səfəvi hökmdarı I Şah Təhmasibin qızı Pərixan xanımın həyatı və fəaliyyəti barədə bəzi məlumatlar // AMEA Tarix İnstitutunun Elmi Əsərləri. XIX c. Bakı, 2007, s.25-46.*

[2687] Baroda nəşri: "əmirliyə".

[2688] *Qurani-Kərim, "Bəqərə" surəsi, 249-cu ayə.*

[2689] Burada göstərilən miladi tarix çərşənbə gününə deyil, cümə axşamı (pəncşənbə) gününə təsadüf edir.

fizəsi, mülk və dövlət qapılarının açarları, din və millət məsələlərinin nizamı onun insaf və fərasət ovcuna, çalışqanlıq və işgüzarlıq barmaqlarına həvalə edildi. Mərəzlərin şəfasının qanunu (problemlərin həllinin çarəsi) olan və məqsədlərin külliyyatını əhatə edən [şah] öz səadətli və uğurlu batininin istəklərini əldə rəhbər tutaraq həmişə şəriət elmlərinin bünövrəsinin möhkəmlənməsi üçün əmək sərf edirdi və kimya kimi təsirli, bilikləri cəmləyən, səadət əlamətlərinin müfəssəli olan ürəyin sahibi [II Şah İsmayıl] fəzilətli üləmaya himayə göstərməyə meyilli idi. Bu dürüst niyyətin adil şahidi və bu məramın doğru sübutu odur ki, çaharşənbə günü, rəbiüləvvəl [ayının] 26-da ali sədarət mənsəbini İsfahanın yüksək dərəcəli seyidlərindən olan öndəgedən mövlana, hikmət fənlərinin hafizi Şah İnayətullaya tapşırıldı və bu mühüm vəzifənin həlli, təşkili, icrası, yerinə yetirilməsi, nizamı və tərtibi onun öhdəsinə qoyuldu. Qərar verildi ki, din əmrinin rəvacında, peyğəmbərlər ağasının (Məhəmməd peyğəmbərin) şəriətinin hökmlərinin təşkilində, xeyriyyə mərkəzlərinin ("büqaül-xeyrat") tərəqqisində, əkinçiliyin, mədaxilin[2690] və vəqflərin çoxaldılmasında (inkişafında) tərifəlayiq səy göstərsin.

### Pələngan qalasının fəthi haqqında söhbət

Uğurlu saata təsadüf edən həmin vaxtlarda izzətli və calallı [şahın] qulağına çatdı ki, Pələngan qalasının[2691] valisi İsgəndər boynunu itaət çənbərindən çıxarıb. Çünki neçə dəfə Kürdüstan hakimləri ilə müharibə məqamına gəlmişdir, onların arasında şücaət və iqtidar baxımından ən güclüsü kimi önə çıxmışdır və indi də həmin iddia onun ürəyindədir. Ona görə də hökmdarın dünyanı bəzəyən düşüncəsi onu cəzalandırmağı qət etdi və qərara aldı. Əmirlik rütbəsinə malik Sulaq Hüseyn Təkəlünü o tərəfə doğru göndərdi. Sulaq ağacların yarpaqları kimi saysız, səhra qumunun ədədindən və bahar yağışlarından daha artıq miqdarda yaraqlı dilavərlərdən [ibarət] bir dəstə ilə hərəkət bayrağını o tərəfə yüksəltdi.

Beyt

"Elə bir ordudur ki, öz tozanağı ilə,
Döyüş günündə Çin dənizini səhraya çevirər".

İsgəndər zəfər nişanlı əsgərlərin xofundan qorxaq-hürkək olub, qaçış və ehtiyatkarlıq üslubuna riayət edərək özünü o hüdudun qalalarına və dağlarına çatdırdı. Oralar elə yerlər idi ki, enişi yerin nəm çəkmiş dibinə və yoxuşu Sürəyyaya çatmışdı. Xəndəyinin sonu balığa və küngürəsinin başı aya birləşmişdi. O vaxtadək ali səviyyəli hökmdarların iqtidar kəməndi onu fəth etmək üçün hasarının küngürəsinə yetişməmiş və kama çatmış sultanların çalışqanlığının yüksək uçan şahbazı onun işğalı havasında qanad çalmamışdı.

Şeir

"Qala demə, bir fələk görkəmli dağdır o,
Ucalıqda fələkdən də hündürdür.
Daş ürəklidir, bərk başlıdır, dar gözlüdür,
Fələklərin şüşəsini daşla sındırmışdır.
Onun küngürəsi olub Sidrəyə nədim,
Edib mişar ilə fələyi iki parça".

Elə ki qızılbaş qoşunları qalanın ətrafına gəlib çatdılar, oranın sakinlərinin ürəklərinə müqayisəyəgəlməz bir qorxu yol tapdı. Amma o diyarın əmirlik şaürına malik valisi İsgəndər orduya döyüş və vuruş atəşini alışdırmağı əmr etdi.

Nəzm

"Zəmanə dikbaşlarının tüklərindən,
Tuti kimi tüklənmişdi asiman.
Onların başlarının tükü dağıldı aya və günəşə,
Asiman uçan qartallar üçün dar oldu.
Təzə ay kimi dağ başından doğan kaman,
Yan-yörəyə öz şövkətini yayırdı.

---

[2690] Burada vəqf torpaqlarında əkinçiliyin inkişafı və bu ərazilərdən gələn gəlirlərin çoxaldılmasından söhbət gedir.
[2691] Pələngan qalası – Şəhrizur yaxınlığındadır *(Seddon, şərhlər, s.295).*

Onun əməlindən yüz fitnə törəyirdi,
Yaraşıqlı cavanlar divardakı cansız şəkilə dönürdü".

Müzəffər və cəsur qoşun neçə gün ərzində qala əhlinə qarşı təzyiq göstərməyə səy etdi, gəliş-gediş yolunu bağladı və giriş-çıxış qapılarını onların üzünə qapatdı. Axırda çoxsaylı qazilərin hamısı birdən atəş kimi aşağıdan yuxarıya üz qoydular. İsgəndər cövşən deşən ox ucu ilə Süha [ulduzunun] bəbəyinin dairəsindən nöqtəni götürən və qəzavü-qədər kimi rəftar edən tüfəngin yarası ilə günəşin gözündən nuru yox edən dilavərlərlə birlikdə,

Beyt

"Oyunçular kimi tək və cüt zər atırdılar,
Oxla bədənlər cütləşirdi, qılıncla başlar təklənirdi".

qarşıdurma və vuruşma qədəmi ilə irəli gəlib qılınc çalmağa və ox atmağa başladı.

Şeir

"Əyri qaşlı kaman öz müjganı ilə,
Cövşənin döşündən süd çıxardı.
Baş parçalayan qılınc elə kəsdi ki,
Başdan göbəyə qədər yarıb keçdi".

Atların əli öldürülənlərin ürəyindən Bədəxşanləlinin rəngini aldı və döyüş meydanının daşı cavanların qanından nar dənəsi rəngli yaqutun görkəminə büründü.

Beytlər

"Dəbilqələr qandan şərab camı oldu,
Əcəl badə paylayan saqi oldu.
Bədən köklərindən qan çıxardı baş,
Qan dəryasından bitdi təzə-tər mərcan".

Tüfəngin qorxusundan əcəl tısbağa kimi başını içəri çəkdi və ürək deşən oxun yarasından döyüş ərinin bədəni kirpi kimi ox tikanları ilə doldu. Düşmənlər və rəqiblər qalibiyyətli qoşunun fəth ayəsini öz gözləri ilə müşahidə və mülahizə etdilər və öz vəziyyətlərinin zəiflik və qüsurdan ibarət olduğunu hiss etdilər. Belə olduqda, onlar fərar ətəyinə əl vurub qala yaxınlığındakı kəndə tərəf qaçdılar. Qazilər o rəzillərin qalanlarını iti qılınc yarası ilə cəhənnəmə vasil etdilər və yüksək bəxtin nərdivanı ilə qalanın başına çıxdılar. Əyyamın yeyin alaca atının aqibətsiz hərəkəti üzündən İsgəndərin murad atı alçaqların üzrü kimi ləng idi və cahanın sahəsi ona paxılların hövsələsi kimi təng (dar) idi. O, fəlakətə mübtəla olmuş iki-üç nəfərlə həmin qırğından xilas oldu. Sulaq Hüseyn bu xəbəri islamın pənahı olan dərgaha göndərdi. Qasid üç[2692] günə Pələngandan Qəzvinə çatdı. Aləmin pənahı olan şah o qalaların hakimliyini Sulaq Hüseynə tapşırdı. O diyarın cəmi sakinləri və ümumi əhalisi öz vəziyyətlərindən fərəhlli və könlü rahat bir şəkildə asayiş beşiyində və asudəlik yatağında yuxuya getdilər və ölkənin əmin-amanlığının, bəndələrin asayişinin səbəbi olan o həzrətin dövlətinə dua etməklə məşğul oldular.

O zaman Bayram bəy Qaramanlunun oğlu Hüsam bəy cəhalət və nadanlıq ucbatından bir fəqiri qətlə yetirib şəhərdə gizləndi. Axırda ələ keçirilib dara çəkildi.

Uğurlu saata təsadüf edən bu vaxtlarda Rey hakimi Ərdoğdu xəlifə Təkəlü həbs edildi. Aləmin pənahı olan şah böyük qorçular arasından oymaqların əmirzadələri olan qırx dörd süvarini tam sürətlə Tehran tərəfə göndərdi ki, Sultan Həsən mirzəni[2693] qətlə yetirsinlər. O qorçulardan iyirmi ikisi bir tərəfdən və iyirmi ikisi digər tərəfdən kəməndi o məzlum şahzadənin boynuna saldılar və onu qətlə yetirdilər[2694].

Həmçinin o zaman aləmin pənahı olan şah Herat vilayətinin idarəçiliyini, orada ədalət yaymağı, oranın əyalət və rəiyyətpərvərlik mərtəbəsini qüdrətli dövlətin sütunlarından və Durmuş xanın nəvələrindən olan Əliqulu xan Şamluya həvalə edib onu çoxlu qoşunla oraya yolladı.

---

[2692] Nuruosmaniyyə nüsxəsi: "iki".

[2693] Sultan Həsən mirzə – Sultan Məhəmməd Xudabəndənin böyük oğlu və I Şah Abbasın böyük qardaşı.

[2694] Nuruosmaniyyə nüsxəsi: "Aləmin pənahı olan şah, Əliqulu sultan Türkmanı bir dəstə qazi ilə birlikdə Tehran tərəfə göndərdi ki, Sultan Həsən mirzəni qətlə yetirsinlər. O, tam sürətlə yola çıxıb qəflətən Tehrana daxil oldu. Sultan Həsən iztiraba düşüb Tehran hakimi Əli xəlifəni xəncərlə vurdu. Lakin axırda öldürüldü".

O zaman dövlətin xəbərçiləri ərz etdilər ki, Əbülxan zəlalət yolunun azğınları və cəhalət çölünün sərgərdanları olan qardaşları ilə birlikdə ayağını həddən kənara qoyub Nişapurun nahiyələrinə qədər basqın etmişdir və ...-də[2695] olan bədbəxtlər dəstəsinin tamahkarlıq qüvvəsi hərəkətə gəlmiş, istilaçılıq bayrağını yüksəltmişlər. Sevindik by Əfşarın oğlu Hüseyn bəy əcəl [kimi] qüvvətli olan çoxsaylı qazilərdən təxminən əlli nəfərlə birlikdə onun ardınca sürətlə yürüş etdi. ...[2696] ətrafında onlar həmin yaramaz və bədbəxt mərdimazarlara çatdılar. Qılınclarının dili fəth və zəfər ayələrini təfsir edən və fitnə nişanlı nizələrinin parıltısı dini və dövləti qoruyan müzəffər qazilər düşmənlərin üzərinə tökülüb, Rəbbin hüsn-rəğbətinin köməyi ilə o hünərsiz qövmdən təqribən yüz nəfəri yaraladılar və öldürdülər, onların başlarını isə aləmin pənahı olan dərgaha göndərdilər.

Seşənbə günündə, rəcəb ayının 5-də (18.09.1577)[2697] Dəkən padşahı Nizamülmülkün[2698] elçiləri Qəzvin şəhərinə gəldilər, peşkəş olaraq çoxlu nağdlar (pullar) və saysız cavahirlər gətirdilər və öz padşahlarının dilindən dedilər:

Nəzm

“Tamam sədaqət və niyaz ilə həmişə,
Bu astananın qulamıyam mən.
Sən bir yerə qədəm qoyduğun zaman,
Torpaq sənin məhəbbətinlə alışıb yanar.
Fələk əgər bədənimə edərsə qübar,
Sənin lütfünün dərmanı ilə tutaram qərar.
Mənim gülümdən açan çiçəkdən il və ay boyu,
Ətir saçsın şahın ehsanının qoxusu”.

Şənbə günü, şaban ayının 20-də (02.11.1577)[2699] aləmin pənahı olan şah öz sevimli oğlu Əbül-Fəvaris Şücaəddin Məhəmmədin ləlәliyini Şiraz hakimi Vəli sultana verdi. O da öz növbəsində böyük bir ziyafət tərtib edib, bütün əmirləri və dövlət ərkanını [oraya] çağırdı. Xoş ahəngli mütrüblərdən ud və çəng nəğməsi ucaldı.

Şeir

“Qıvraq və şirin dilli bütün mütrüblər,
Şükür nəğməsini tökdülər barmaqlarından.
Mütrübün əlində dəf alırdı kam,
Günəşin pəncəsində ay idi sanki o.
Şəkər dodaqlı gözəllər tərənnüm edir,
Cahan şövkət ilə dolur başdan-ayağa.
Əcəb bir məclisdir, lap cənnət kimi,
Onun şərab piyaləsi daşan su kasası kimidir”.

Aləmin pənahı olan şah təşrif gətirib taxtda qərar tutdu.

Beyt

“Çıxdı cahangir Süleyman,
Günəş kimi ürək oxşayan taxta.
Sarayının pərdəsi asimana həsəd verir,
Ona asiman atlası əkizdir.
Pəri üzlülər ədəb qaydası ilə,
Qönçətək dodaqlarını söhbətə bağladılar.
Sənubər qamətlilər hər tərəfdə durdular,
Onların tellərindən fitnə qaldırmışdı baş”.

---

[2695] Bütün nüsxələrdə yeri boş buraxılmışdır.
[2696] Bütün nüsxələrdə yeri boş buraxılmışdır.
[2697] Göstərilən miladi tarix çərşənbə gününə təsadüf etmişdir.
[2698] Əhmədnəgərin Nizamşahlar sülaləsindən olan hökmdarı Mürtəza (h. 972-996 / m. 1565-1588) nəzərdə tutulur *(Seddon, şərhlər, s.295).*
[2699] Baroda nəşri: “Seşənbə günü, şaban ayının 3-də”.

Vəli sultan [hökmdara] həddən və hesabdan artıq sayda qatar dəvələr, yorğa qatırlar, Kıbrıs zirehləri və Rus kürkləri hədiyyə etdi.

Cümə gecəsi, şaban [ayının] 24-də (06.11.1577)[2700] uzunluğu yarım fələk qövsü olan iri zuzuabə (kometa) qövs bürcündə peyda oldu.

Yekşənbə günü[2701], ramazan [ayının] 13-də (24.11.1577) aləmin pənahı olan şah fani aləmdən əbədi cahana köçdü. Bu mövzunun gerçəyi belədir ki, həmin gecədə o həzrət gözəl yerişli atına minib, himayədarlıq göstərdiyi Həsən bəy Halvaçıoğlu və yaxınlarından bir neçə nəfərlələ birlikdə küçə və bazarda seyrə çıxmışdı. Səhərə yaxın Həsən bəyin evinə gəlib istirahət etdiyi zaman qəflətən asimani qəzavü-qədər divanından onun fani həyatı tərk etməsi haqqında fərman "Ölümü və həyatı yaradan Odur"[2702] tuğrası və "Şübhəsiz ki, sən də öləcəksən, onlar da öləcəklər!"[2703] məzmunu ilə bəzədilərək əcəl elçilərinin əli ilə ona çatdırıldı. O, aləm hökmranlığını namuradlıq nəfsi[2704] ilə yoxluq küləyinə verdi.

Nəzm

"Bu evdən köçəcəyi yəqin olsa da,
Lakin heç kəs bunu güman etmir.
Cahan səbatsızdır və daim belə olmuşdur,
Çünki o, fani bir saraydır".

Onun qətlinin səbəbi budur ki, Həsən bəy Halvaçıoğluya bənd olub ondan bir an belə ayrılmazdı. O, (yəni Həsən bəy) bu vəziyyətdən təngə gəldi. O namərd (Həsən bəy) rəzil alçaqlarla və hiyləgər gədalarla söhbətə adət etdiyindən şahın düşmənləri ilə əlbir oldu. Pərixan xanım da onun anasını aldadıb yoldan çıxardı və onun qətlində müttəfiq oldular.

O divə bənzər hökmdar dövlət sahiblərinə lazım olan ehtiyatkarlığa riayət etməyi yerə qoyub tək-tənha onun (Həsən bəyin) evinə gəldi ki, istirahət etsin. Onlar fil iliyini[2705] yeməyinə qatıb ona verdilər. O, yuxuya gedəndən sonra onu boğdular. Həmçinin eşidilmişdir ki, onun xayasını da sıxmışlar. Nadir təsadüflərdən [biri] odur ki, Qəhqəhə qalasında olduğu zaman dinin pənahı olan şaha yazmışdı: "Düşmənlərin qəsdindən və qadınların məkrindən qafil olma ki, məbada, sənin xayanı tutub Kiçik Şeyx Həsən kimi həlak edərlər"[2706]. Həmçinin Salmanın[2707] o barədə dediyi beytləri də yazmışdı.

Səltənəti zamanında Səbzəvarda iki yüz tümənə icarəyə verilmiş mis mədənini beş min tümənə qərarlaşdırdı. Cəmi İsfahanın [vergisinin] otuz min tümən olmasına qərar verdi. Bütün məmaliki-məhrusənin [vergisini] dörddə bir [qədər] artırdı. Hökm etdi ki, heç kəs əmlak yeməsin və qazılar qəbalə yazmasınlar. Seyidlərin və üləmanın soyurğallarını kəsdi və camaatı Şafei məzhəbinə döndərmək istədi. Ona görə də qızılbaş qoşunu ona nifrət etdi[2708].

Onun ölümündən sonra əmirlər və dövlət ərkanı dövlətxananın qapısında toplanıb məşvərət etdilər. Əhd-peyman bağladıqdan və "Quran"a and içdikdən sonra aləmin və aləm sakinlərinin şahzadəsi Sultan Məhəmməd Xudabəndənin səltənətinə qərar verdilər və dəstə-dəstə Şiraza yollandılar.

---

[2700] Göstərilən miladi tarix çərşənbə gününə təsadüf etmişdir.
[2701] Baroda nəşri: "gecəsi".
[2702] *Qurani-Kərim, "Mülk" surəsi, 2-ci ayə.*
[2703] *Qurani-Kərim, "Zumər" surəsi, 30-cu ayə.*
[2704] Bodleian nüsxəsi: "namuradlıq naxışı"; Tehran nəşri: "namərdlik eşqi".
[2705] Ç.N.Seddona *(Şərhlər, s.295)* görə, bu terminlə xüsusi bir tiryək növü nəzərdə tutulmuşdur.
[2706] Çobanilər sülaləsindən olan Kiçik Şeyx Həsən 16 dekabr 1343-cü ildə zövcəsi İzzət Mələk tərəfindən öldürülmüşdür *(V.Z.Piriyev. Azərbaycan XIII-XIV əsrlərdə, s.147).*
[2707] Çox güman ki, İran şairi Xoca Cəmaləddin Salman Savəci (1309-1376) nəzərdə tutulur.
[2708] Ə.Nəvai son üç abzasda verilmiş parçanı Nuruosmaniyyə nüsxəsindən əlavə etmişdir. Ç.N.Seddonun nəşrində isə həmin üç abzasın əvəzinə bu parça yer almışdır: "Bəzilərindən belə eşidilmişdir ki, Həsən bəy Halvaçıoğlu onun düşmənləri ilə əlbir olub ona yeməyə fil iliyi vermişlər və daha sonra onu boğmuşlar. Nadir təsadüflərdəndir ki, Misir padşahı İsmayıl ibn Hafiz Lidinillah da öz cavan xidmətçisinin əli ilə bu tərzdə öldürülmüşdür. Onların əhvalatı yeddinci cilddə təfsilatı ilə qeyd edilmişdir. Amma ən doğrusu budur ki, [II Şah İsmayıl] öldürülməmişdir. Çünki o, ifrat dərəcədə tiryək atardı və şiddətli sancısı vardı. Gündə bir dəfə onu sancı tutardı. Belə ki, [onu görən] insanlar iztiraba düşərdilər".

**Aləmin və aləm sakinlərinin şahı Sultan Məhəmməd Xudabəndə padşahın əhvalı haqqında**

938-ci ildə (15.08.1531 – 03.08.1532) yoxluq gizlinliyindən mövcudluq aləminə qədəm qoydu və yer üzünü ay simalı çöhrəsi ilə parladaraq mavi asimanın yerə həsəd aparmasına səbəb oldu.

Nəzm

"Qönçə gül dövlət bağında boy atdı,
Bu cür gülü dünyanın gözü görməmişdi".

* * * * *

"Şahlıq dəryasından qiymətli bir dürr,
İlahi nurdan qaynaqlanan işıqlı bir çıraq.
Mübarək görkəmli və parlaq kürsülü,
Taleyinə taxt-tac sahibi olmaq yazılıb".

Boya-başa çatma zamanında səltənət və hökmdarlıq əlamətləri və cahandarlıq nişanələri səadətli çöhrəsindən zahir və aydın idi. Ondan qeyri-adi xüsusiyyətlər üzə çıxırdı. Dinin pənahı olan şah, əmirülüməra Hüseyn xan Şamlunu o cənabın lələsi [təyin] etmişdi. Ondan sonra bu əbədi dövlətin möhkəm sütunu olan Məntəşa sultan Ustaclu [onun] lələsi oldu. 942-ci ilin (02.07.1535 – 19.06.1536) axırlarında Xorasan səltənətinə təyin edildi. İtaəti vacib olan fərmana əsasən, Məhəmməd xan Şərəfəddinoğlu Təkəlü nadir Herat mülkünün idarəçilik işlərini və o həzrətin qoşununun sərkərdəliyini öz öhdəsinə aldı. Ta o zamana qədər ki, iqbal fidanı cah-calal bostanında şirin su ilə ucaldı, onun dövlətinin südəmər tüfili əmin-amanlıq beşiyindən İlahi ehsan tərbiyəsinin xoşbəxtliyi və Rəbbin lütfünün himayəsi ilə həddi-büluğ və yetinlik taxtı üzərinə çıxdı, ağıl tacı, ədalət və insaf xələti ilə başı uca, əziz və şərəfli oldu, sərvərlik darülmülkünün qapısını və rəiyyətpərvərlik darvazalarını açdı. Fitnələrin hücumu və möhnətlərin ümumu ilə alt-üst olmuş Xorasan vilayəti o həzrətin dövlətinin rövnəqi ilə abad oldu, fitnə və çaxnaşma tozuna bulaşmış mülk və millət çöhrəsi o həzrətin ədalət yağışı ilə pak oldu. Bayrağını fələklərin damına çəkmiş və pis xilqətli özbəklərin şeypurunun küləyi ilə günəş məşəli üzərinə şölə salmış məmləkəti yandıran ataş fəlakəti onun tədbir suyu ilə yatdı. Daim Xorasanı tarac edən Übeyd xan Özbək öldü. 963-cü ildə (16.11.1555 – 03.11.1556) dinin pənahı olan şah o həzrəti yanına çağırdı. Fərmana əsasən, cümə günü, şaban [ayının] 4-də (13.06.1556)[2709] gözəl Herat şəhərindən çıxıb mənzilləri və mərhələləri qət etdikdən sonra calal sahibinin (Allahın) yardımı ilə şəvvalın (08.08-05.09.1556) axırında aləmin pənahı olan dərgaha çatdı, növbənöv şahanə nəvazişlərlə və ata qayğısı ilə üzləşdi. 964-cü ildə (04.11.1556 – 23.10.1557) yenidən Herat hakimliyi o həzrətə həvalə edildi. Şənbə günü, səfər [ayının] 9-da (11.12.1556) zəfər nişanlı əsgərlərlə o tərəfə hərəkət etdi. Məşhədin ətrafı izzət və calal çadılarının düşərgəsi oldu, əzəmət və səadət günəşinin şəfəqi, böyüklük və hökmranlıq nurlarının parıltısı Xorasan vilayətinin ətrafına və yan-yörəsinə düşdü. O əsnada qeybdən gələn səda şəksiz və şübhəsiz surətdə "Allah [bəndələrini] əmin-amanlıq yurduna çağırır və istədiyini doğru yola salır!"[2710] [ayəsinin] nazil sədasını və təfsir müjdəsini o həzrətin qulağına çatdırdı. İmam Əli ibn Musa ər-Rzanın müqəddəs və nurlu rövzəsini ziyarət etməyə yollandı.

Nəzm

"Yüyəni tapşırdı qəzavü-qədərin əlinə,
Yollandı Əli Rzanın tərəfinə.
Haqq imamı, din əhlinin Kəbəsi,
Xorasan torpağının qərib şəhidi.
Onun türbəsi ənbər qoxulu cənnət bağıdır,
Hər tərəfində behiştə açılan pəncərə var.
Onun qapısını mələklər ziyarət edir,
Sanki o, təvaf olunan müqəddəs Kəbədir.
Məsihlə Xızır onun bargahına üz tutub,
Onun səhər çağı əsən mehi can bəxş edir.

[2709] Göstərilən miladi tarix cümə gününə deyil, cümə axşamı (pəncşənbə) gününə təsadüf edir.
[2710] *Qurani-Kərim, "Yunus" surəsi, 25-ci ayə.*

Qapısına gedib rizvan hurinin müjganı ilə,
Günəş oraya nurdan bir xalı sərib".

O, mübarək məqbərənin içinə girdi və ziyarət şərtlərini yerinə yetirdi. Dərya qədər geniş ürəyində qərar tutduğu kimi, o müqəddəs rövzədə nurların müşahidəsi və sirlərin mütaliəsi baş verdi. Böyük seyidləri və möhtərəm mücavirləri hüsn-rəğbətə və ehtirama layiq gördü. Ehtiyac sahiblərinə və kasıblara nəzir və sədəqələrin verilməsini buyurdu. Seşənbə günü, rəbiüssani [ayının] 9-da (09.02.1557) əzəmət və səadətlə Herata daxil olub insaf və ədalət büsatını qurdu.

Qazağın qətlindən sonra dinin pənahı olan şahın əmrinə uyğun olaraq, Qəzvin şəhərinə tərəf hərəkətə gəldi. Əmir Qeyb bəy Ustaclunun Herat hakimi vəzifəsinin öhdəsindən gələ bilmədiyi aydınlığa qovuşduqda dinin pənahı olan şah yenidən Xorasan vilayətinin hökumət yüyənini o həzrətin iqtidar ovcuna verdi və o, həmin tərəfə doğru yola düşdü. Şahqulu sultan Yegan o həzrətin xidmətində idi.

O zaman Abdulla xan ibn İsgəndər ibn Canibəy sultan və Xosrov sultan yaxşı silahlanmış otuz min süvari ilə Xorasan vilayətinə gəlmişdilər. O həzrət əsla onlardan çəkinməyib üç yüz süvari ilə o çoxsaylı qoşunun üzərinə yollandı. Hərçənd xeyirxah adamlar aləm sakinlərinin şahzadəsinə "bir qədər gözləmək lazımdır ki, Xorasan əmirləri çoxlu qoşunlarla səadətli orduya üz tutub qoşulsunlar" deyə təklif etsələr də, o həzrət öz doğru düşüncəsi ilə həmin söhbəti qəbul etməyərək igidliklə yola çıxdı və Türbət qalasına daxil oldu. Abdulla xan və Xosrov xan o ətrafda mövqe tutdular və yaxşı silahlanmış qoşunlar hər gün adlı-sanlı özbəklərlə mücadilə və mübarizə etdilər. Neçə gündən sonra xırman yandıran özbəklər tam məyusluq, pərişanlıq və utancla hərəkət, bəlkə də, qaçış bayrağını Buxaraya tərəf qaldırdılar.

Beləliklə, Abdulla xanın və digər özbəklərin təkəbbür zirvəsinə yüksəlmiş şövkət və iqtidar bayraqları aşağı endi, onların yardımçılarının, tərəfdarlarının və qoşun heyətlərinin saysızlığı ucbatından təsəvvür və xəyal lövhəsi üzərinə çəkdikləri lovğalıq və qürur naxışları zay oldu. O sərvər (Xudabəndə) köç edib Xiyaban küçəsindən dəbdəbəli şəkildə dövlətxanaya daxil oldu. Neçə ildən sonra dinin pənahı olan şahın əmri ilə hərəkət bayrağını Şiraza tərəf yüksəltdi və Herat hakimliyini öz sevimli oğlu Abbas mirzəyə həvalə etdi. Xorasan vilayətinin sakinlərinin hamısı birdən ayrılıq əziyyətinə düşdülər və mühacirətin qəmli səmum küləyinə giriftar olub zəhər dadlı hicran camını qurtumlamağa könül verdilər. O həzrət düşmənləri məhv edən qoşunlarla Şiraz şəhərinə daxil oldu.

Nəzm

"Dəbdəbə ilə getdi səadət meydanına,
Dövlətin rövnəqi və cavanlığın zinəti ilə.
Apardı qarşısından tez rəftarlı fələyin,
Kərəm çovqanı ilə əmin-amanlıq topunu".

Elə ki dinin pənahı olan şahın ölüm xəbəri Şiraza çatdı, o həzrətin xoş niyyətli qəlbində səltənət iddiası yetişdi. Amma o diyarın valisi Vəli sultan dövlətə arxa çevirdi və səadətli məiyyətdən ayrılıb Qəzvinə yola düşdü. Məiyyət dəstələri və qoşun təbəqələri həmçinin vəfasızlıq yoluna riayət edib hamısı Qəzvin şəhərinə yollandılar. Ona görə də o həzrət adət-ənənə və şəriət baxımından ona çatan səltənəti tərk edib düşündü ki, əgər səltənət iddiası edərsə, nahaq qan axacaq. Ona görə də şəhərdə sakin oldu və qeybdən gələcək hadisənin intizarını çəkdi.

"Sən mülkü istədiyin kəsdən geri alırsan" ayəsinə əsasən, İsmayıl mirzənin cah-calal ayı fanilik məğribinə çatdıqda, "Sən mülkü istədiyin kəsə verirsən"[2711] kəlamının zərurətinə uyğun olaraq, ali mənşəli hökmdarın dövlət və səadət günəşi izzət və şövkət üfüqündən doğdu. Dərgah əmirləri, ordu sərdarları, yüksək məqamlı vəzirlər, din böyükləri və imamları, dövlət sahibləri, mənsəb və həşəmət yiyələri dərgaha üz tutdular. İlk öncə İsgəndər bəy Şamlu altı gün ərzində Qəzvindən Şiraza getdi və padşahlıq müjdəsini çatdırdı. Əvvəlcə bu xəbərin [doğruluğunu] qəbul etməsələr də, [gerçəkliyi] aydın olduqdan sonra onu xan [təyin] etdilər və ona "Xoşxəbər xan" adını qoydular.

Ertəsi gün Məhəmmədxan sultan Zülqədərin oğlu Əli bəy zəfər şüarlı əsgərlərdən qabaq şəhərə daxil olub İsmayıl mirzənin ölüm xəbərini ərz etdi. O həzrət səadətli tale və şərəfli bəxt ilə səltənətə cülus etdi. Or-

[2711] Hər iki iqtibasın qaynağı: *Qurani-Kərim, "Ali-İmran" surəsi, 26-cı ayə.*

dunun toplanmasından və döyüşkən bahadırların mükəmməl olmasından sonra hərəkət bayrağını Qəzvinə tərəf yüksəltdi.

Nəzm

“Gethaget vaxtı kosdan qışqırıq çıxdı,
Elə bir qışqırıq ki, ondan sərsəm oldu div.
İki yüz toz dağı Sürəyyadan keçdi,
Yerin başı uca səmadan keçdi.
Süvarilərin əlində nizə və tüfəng,
Parlaq ulduzla doludur yer, lap fələk kimi”.

Şöhrətli Şiraz şəhərinin idarəçiliyini ətrafı və yan-yörəsi ilə birlikdə Məhəmmədxan sultan Zülqədərin oğlu Əli bəyə həvalə etdi, Vəli sultan Zülqədəri və Təbət ağanın oğlu Şahqulu sultanı tutmağa adamlar göndərdi.

Mübarək çətir uğur kölgəsini İsfahan sakinlərinin başı üzərinə saldıqda Hüseynqulu sultan Şamlu aləmin pənahı olan dərgaha gəldi, çadır, alaçıq, saray pərdəsi və bargah gətirib hökmdarın evinin qapısını lazımınca qorudu. O zaman şahın qələbə ayətli bayraqlarının hərəkətinin sədası və şahənşahın keçid müjdəsi o diyarda dillərə və ağızlara düşdü. Əbədi dövlətin günəşi o vilayətin ətrafını və yan-yörəsini nurlandırdı. Bu sətirlərin müəllifi [Həsən bəy Rumlu] aləmin pənahı olan şaha mülazimlik etməyin ehramını canının ortasına bağlayıb, Qum şəhərində uğur qibləsinə təzim etmək şərəfinə nail olaraq tam ehtiramla qarşılandı və müqərrəblər cərgəsində qərar tutdu.

Dang ribatı izzət və calal çadırlarının qurulduğu yer olduqda Əmir xan Türkman, Xəlil xan Əfşar, Qulu bəy Qorçubaşı və b. yüksək şanlı əmirlər aləmin pənahı olan dərgaha gəldilər. Ribatdan ayrıldıqdan sonra Pirə Məhəmməd xan Ustaclu, Xəlifə Ənsar və ali mənşəli əmirlərdən bir çoxları müzəffər orduya qoşuldular.

Hökmdarın məiyyəti Qəzvin şəhərinin ərazisini taleyin bəxşiş alaylarının ulduzları ilə zinətləndirdiyi zaman Süleyman padşah ibn Sultan Üveys ibn Sultan Mahmud ibn Sultan Əbu-Səid ibn Mirzə Sultan Şah Məhəmməd ibn Mirzə Miranşah ibn Sahibqiran Əmir Teymur Kürəkan[2712] aləmin pənahı olan dərgaha gəldi və bu beytləri əzbər söylədi:

Beytlər

“Ey şah, sənin qapın aləm şahlarının qibləsidir,
Fələk sənin tərəfindədir və dünya sənə tabedir.
Şahlıq rütbəsi bir tək sənə layiqdir,
Həmd olsun Allaha ki, tək olan hər nə varsa, möhkəmdir”.

Ona tam ehtiram göstərildi və öz mənzillərinə geri qayıtdı.

O əsnada Pərixan xanımın və Şamxal sultanın müxalifliyi [haqqında] xəbər gəldi. Bunun icmalı belədir ki, nəqşbəndlər onların xəyal aynasında İran səltənətinin ələ keçirilməsinin çox asan olacağı barədə təsəvvür yaratmış və Pərixan xanımın evini möhkəmləndirmişdilər. Avaralardan, əclaflardan, ədəbsizlərdən və yaramazlardan [ibarət] bir dəstə də onların yanına gəlmişdi. Şamxal sultan onların varlığı ilə məğrur olmuşdu. Pərixan xanım o əbləhlərlə birlikdə qərar vermişdi ki, savaş və döyüş günü əgər qılınc buludundan bəla tufanı yağsa və iti xəncərdən fəna (ölüm) atəşi saçılsa, onların ətəyi üzərinə bir yara və onların köynəklərinin qaytanına bir qığılcım düşməz və hadisələrin tünd küləyindən onların qolçaqlarının səthinə və kandarlarının tərəfinə toz qonmaz. Necə batil bir təsəvvür, necə boş bir xəyal!

O həzrət mürüvvətinin çoxluğundan onların yanına yaxşı nitq qabiliyyətinə malik adamlar göndərib xəbər verdi: “Bilin ki, calal sahibi olan həzrət (Allah) bizim dövlətimizin səadətli bayraqlarını uca şanlı və yüksək təməlli etmiş, yer üzünə bizim ədalət əsasımzı və həşəmət libasımızı yaymışdır (döşəmişdir, sərmişdir). Bizim qeyrətimizin qəhrəmanı hər kimin üzərindən zəlillik xətti çəkərsə, qəzavü-qədərin naqqaşı tale qələmi ilə onun varlıq naxışını mövcudluq vərəqləri üzərindən məhv edər. Bizim iqbal günəşimiz, izzət və

[2712] Süleyman padşah (Mirzə Süleyman) – keçmiş Bədəxşan hakimi, Baburun əmisi nəvəsi. 954 / 1547-ci ildə Hümayun padşah tərəfindən məğlubiyyətə uğradılmış, lakin itaətini bildirdikdən sonra öz vəzifəsində saxlanmışdır. Onun hakimiyyətinə özbək hökmdarı Abdulla ibn İsgəndər tərəfindən son qoyulmuşdur *(Seddon, şərhlər, s.295).*

calal ulduzumuz qəhr şəfəqini hər kimin üzərinə salarsa, onu arvad-uşağı, qohum-əqrəbası və nəsli ilə birlikdə yox edər. Gərək ki, müxaliflikdən əl çəkib dərgaha tələsəsən və əmirlər cərgəsində qərar tutasan. Darvaza və qapı bağlamaqdan bir fayda hasil olmaz”.

Beytlər

“Qapını bağlasan da, səndən əl çəkməyəcəyik,
Əgər qapını bağlasan, damdan da yol var.
Evin qapısını günəşin üzünə bağlasan da,
O, hicabsız şəkildə nəfəslikdən içəri girəcək”.

Onlar ağlın azlığı və cəhalətin çoxluğu ucbatından yola gəlmədilər. Beləliklə, qəflət pası nəsihət sığalı ilə onların kirli könlünün lövhəsindən təmizlənmədi, lütf, təzyiq, təhbeh, təhdid, vəd və xəbərdarlıq kəlmələrinin təsiri olmadı.

Nəzm

“Qəzəb üzündən aləmin pənahı olan şah,
Ordu başçıları ilə danışıb dedi ki:
O alçaqda vəfa adəti yoxdur,
O olmaz bizimlə səfa məqamında.
Yalandır və əbəsdir onun sözü və əməli,
Olmaz bir kəs agah onun işindən.
Dil açdılar aydın ürəklilər [və dedilər] ki:
Sənin dərgahın bəxtiyarların qibləsidir.
Sənsən fələk səmasında günəş,
Sənin feyzindən bütün aləm kam alır.
Yüz ürəklə istəməsə səni əgər səma,
Onun ürəyi yüz para olsun günəşin qılıncı ilə.
Bütün intiqamını düşməndən alarıq,
Sənin hökmündən əsla boyun qaçırmarıq”.

Amma Şamxal sultan və Pərixan xanım öz əməllərindən peşman idilər. Lakin onların fitnəkar düşüncələrinin fəsadları asayiş dairəsindən keçmişdi. Balıq kimi iztirab toruna düşmüşdülər. Xofdan qan onların damarlarının məcrasında dondu, padşahın heybətindən onların kəlləsinin böyük çuxurlarında beyinləri əridi və qorxudan onların nəfəs yolu tutuldu.

Misra

“Sənin düşmənin çətinliklə nəfəs alır”.

Ondan sonra fələk [kimi] şövkətli ordu Qəzvinə doğru hərəkətə gəldi. Elə ki hökmdarın zərnigar tuğunun ayparası ədalət və inancla Qəzvin darvazasının üfüqündən doğdu, Şamxal sultan kölgə kimi günəşə tab gətirməyib zülməttək günəşin parlaqlığından üz çevirdi, öz qara bəxtinin axşamı kimi qürub məğribində gizli və pünhan olaraq çarəsizlik və iztirab üzündən Səbzikar kəndinə getdi. O, Əmiraslan bəy Əfşarın ətəyindən yapışdı. O da onun zamanın Rüstəmi və dövranın İsgəndəri ilə bərabərlik iddiasına malik şərlə dolu başını bədənindən ayırıb, aləmin pənahı olan dərgaha gətirərək zillət torpağı üzərinə atdı. Pərixan xanım yüz qəm və kədərlə özünü hərəmə saldı. O həzrət onu Xəlil xan Əfşara tapşırdı. O da onu o biri dünyaya yolladı.

Pəncşənbə günü, zilhiccə ayının 5-də (13.02.1578) o həzrət dövlət atına minib cah-calalla hökmdar sarayına daxil oldu. Çox-çox (dəstə-dəstə) dərgah əmirləri, bargah müqərrəbləri, seyidlər, mollalar, hakimlər, kələntərlər, ağalar (“ərbab”) və əhali dərgaha gəlib öz vəziyyətlərinə uyğun şəkildə ehtirama layiq görüldülər. Minbərlər və dinarlar onun mübarək adı ilə bəzək və zinət tapdı. Vəzirlik mənsəbi Mirzə Salmana həvalə edildi. Ali mənşəli vəzir müdrikliyinin və biliyinin bolluğu ilə mülki idarəçiliyi həyata keçirdi, ürəklərdən qorxu pasını və şübhə rəngini ehsan sığalı ilə təmizlədi. Bu böyük vəzifənin və incə işin zərurətini yerinə yetirməyə başlayıb, bütün əmrlərdə və qadağalarda Həzrət İlahinin xofunu və qorxusunu göz önündə saxlayaraq hikmət qaydalarının istiqamətləndirilməsi və hökmlərin icrasında ümumi xalqla və bütün camaatla o tərzdə rəftar etdi ki, onun işində heç bir əyər-əskik təsəvvür edilməsin. Zalımların cəzalandırılması və məzlumlara himayə göstərilməsi üçün çalışdı, tərəfkeşliyə, ayrıseçkiliyə, səhlənkarlığa və qəflətə yol vermədi. Divan

malının çoxaldılmasında, kəndlilərə və əkinçilərə qayğıkeşlikdə imkanının yetdiyi qədər çox səy göstərdi. Əsgərlərin ülufələrinin verilməsində və ehtiyac sahiblərinə maddi yardın göstərilməsində, bir dəqiqə olsun, laqeydlik etmədi.

Cahanın pənahı olan şah yüksəyə qalxan günəş kimi qızıl taxt üzərinə çıxıb əyləşdi, dirhəm və dinarı nur şüaları kimi xalqın üzərinə saçdı.

"Nemət xəzinəsinin qapısı açıldı,
Bütün xalqın ürəyi valeh oldu.
Hava təmizləndi onun nəfəslərindən,
Qəm yazısı ürəkdən silinib getdi".

Dinin pənahı olan şahın Qəzvindəki nağd cavahiratdan, mallardan və hərb alətlərindən [ibarət] xəzinələri əmirlərə, əməlisalehlərə, seyidlərə, fəqirlərə, əsgərlərə, səfərdə və hüzurda olanlara paylandı. Dinin pənahı olan şah qoşunun məvacibini on dörd il müddətində verməsə də, o həzrət hamısını şəfqətlə ödədi. Belə ki, məchul bir adam iki yüz tümən, üç yüz tümən aldı. Cahan sakinləri Ugetay Qaanın[2713] səxavətini unutqanlıq tağı üzərinə qoydular. Adəm zamanından ta hicri tarixinin 985-ci ilə çatdığı hazırkı zamana kimi iqtidar sahibi olan heç bir padşah qoşuna bu qədər qızıl verməmişdir.

Ədalətpərvərliyin cahangir şeypurunun zümzüməsi və İsgəndər [uğuruna bənzər] uğurun kosunun təntənəsi ətrafa və yan-yörəyə çatdıqda islam vilayətlərinin hakimləri ərəbin və əcəmin (ərəblərin və qeyri-ərəblərin) padşahının dərgahına xoş söhbətli elçilər və xeyirli qədəmlərə malik səfirlər göndərib bəndəlik və itaət izhar etdilər.

Həmçinin bu zaman cavan şah Təbriz şəhərinin idarəçiliyini Əmir xan Türkmana həvalə etdi, Ərdəbil əyalətini, ona tabe və daxil olan əraziləri Pirə Məhəmməd xan Ustacluya verdi və Əliqulu sultan Türkmana Xoy hakimliyini tapşırdı.

Həmin əsnada Azərbaycandan xəbər gəldi ki, üzüqara kürdlər Xoy şəhərinə basqın etmişlər. Onların müxalifliyinin şərhi belədir ki, İsmayıl mirzə səltənətə oturduqdan sonra Şahqulu Bəlilan Kürdün oğlu Qazi bəy məhəbbət və dostluq silsiləsini hərəkətə gətirib təbrik üçün Qəzvinə elçilər və məktublar göndərdi, bəndəlik və itaət izhar etdi. Bu tərəfdən də Səlmas və Təsuc[2714] hakimliyinin fərmanı ona göndərildi (O, şah tərəfindən verilmiş fərmanla Səlmas və Təsuc hakimi təyin edildi). O, İsmayıl mirzənin [dünyadan] köçməsi xəbərini eşitdikdə tələskənliyindən peşman oldu; ayağını haqq yoldan və qədəmini doğru yöndən kənara qoyub, bir dəstə kürdlə sürətli yürüş edərək Xoya gəldi. O vaxt həmin diyarın valisi olan Mahmud bəy Rumlu iki yüz süvari ilə onu qarşılamağa tələsdi. O, Vələdian kəndi ətrafında kürdlərlə üzləşdi, lakin qılınc və mizraq işlətmədən qaçışa üz qoydu. Kürdər ondan və oğullarından əl çəkib o şəhərə basqın etdilər və istila bayrağını yüksəltdilər.

O zaman kürdlərdən [ibarət] çoxsaylı bir dəstə Qazıqıranın oğulları ilə ittifaqda Hüseyncan sultan Xınıslunun üzərinə gəldilər. Hüseyncan sultan bir kəndə sığınıb, təqribən min iki yüz süvari ilə ölümü gözə alaraq təxminən bir ay o azğın qövmə qarşı savaşdı. Həmin vaxt Van və Vostan ordusu, Şahqulu Bəlilanın oğlu Qazi bəy tam qələbəliklə kürdlərə yardıma gəldilər. O gün səhərdən axşamacan döyüş və vuruş atəşi son dərəcə şiddətlə alovlandı və şölələndi. Hər iki tərəfdən bir çoxları həlak torpağı üzərinə düşdülər. Onların məqsəd oxu mətləb hədəfinə çatmadığı üçün məkr və fırıldaq üzündən Hüseyncan sultanın yanına yaxşı nitq qabiliyyətinə malik elçilər göndərdilər, dostluqdan, sədaqətdən, məhəbbətdən və uzlaşmadan dəm vurdular. Xınıslular əhd-peyman qaydalarının möhkəmləndirilməsindən və "Quran"a and içildikdən sonra kürdlərin yanına getdilər. Onlar əksər qaziləri qətlə yetirib onların kiçik və böyük övladlarını əzab təpiklərinin altına atdılar.

Həmçinin o zaman Ərzurum paşası çoxlu ordu cəmləyib Şuregelə gəlmək istədi. Onun mötəbər əmirlərindən olan Qulaməli oğlu Mirzə Əli bəy qürur üzündən məruzə etdi ki, sizin gəlməyinizə ehtiyac yoxdur, bəndəniz Şuregel hakimini qolu bağlı hüzurunuza gətirəcəyəm. Ona görə də paşa Əlini tam təchizatlı yeddi min nizədar süvari ilə Şuregelə basqın etməyə yolladı. Rumilər tam qətiyyət və təntənə ilə və xəyalın idrakından kənar bir lovğalıq və qürurla qeyri-ənənəvi bir yoldan [keçərək] Qaraxan bəy Bayburtlunun üstü-

---

[2713] Ugetay Qaan – Çingiz xanın oğludur. Öz səxavəti ilə məşhurlaşmışdı *(Seddon, şərhlər, s.296).*
[2714] Təsuc – Cənubi Azərbaycanda, Urmiya gölünün şimal sahillərində qəsəbə *(Хамдаллах Казвини. Нузхат ал-кулуб, с.43).*

nə gəldilər ki, dövlət topunu hiylə çovqanı ilə səadət meydanından aparsınlar. Onlar qəflətən o ətrafa çatdıqda o diyarın valisi Qaraxan bəy hər birisi özünü Rüstəmə və İsfəndiyara tay bilən dörd min süvari ilə rumilərin qarşısında döyüş və savaş səfi tərtib etdi.

Beytlər

"Hamısı döyüş meydanında Rüstəm kimi,
Söhbətdə hamısı dillər əzbəri.
Nəzir verməkdə dərya qədər əliaçıqdırlar,
Davada Nəcəf çölünün aslanına bənzərlər".

Əjdahaya oxşayan nizələri külək rəftarlı yeyin atlarının qulaqları üzərinə qoyub, əcəl kimi özlərini o çoxsaylı qoşuna vuraraq təxminən əlli nəfəri birdəfəyə izzət yəhərindən zillət torpağı üzərinə saldılar.

Beytlər

"Qılınclar bədənləri yardı,
Bədənlərdəki yarıq qılınclara qılaf oldu.
Pəhləvanlar qətlə yetirildi,
Başlarını ölüm yaxası içinə çəkdilər".

Bir dəstə qazi baş kəsmək üçün atdan enmişdi. Rumilər onları öldürüb, qaziləri yerlərindən dəbərdərək kəndə qədər qovdular. Qaraxan bəyin çadırına isə od vurdular.

Qaraxan bəy öz adamlarına ürək-dirək verib onları müharibəyə rəğbətləndirdi:

- Rumilərin iş bacaran və dövranın igidləri olan əksər adamları öldürülmüşdür. Onların atılıb-düşməyindən qorxmayın!

Bu minvalla o, qoşunu cəsarətləndirdi. Hamısı birdən yenidən o çoxsaylı orduya həmlə etdilər. Rumilər qazilərin təzyiqinə və şiddətinə tab gətirməyib savaş meydanından fərar vadisinə üz çevirdilər. Qızılbaş ordusu igidliklə onları təqib edib təqribən üç yüz nəfəri qətlə yetirdi. Onlar can qorxusundan ətrafa və yan-yörəyə pərakəndə oldular. Təqribən daha dörd yüz nəfər qarın çoxluğundan (çoxlu qar ucbatından) həlak oldu. Mirzə Əli bəy pərişan və bədhal vəziyyətdə özünü Ərzuruma saldı.

(mənbənin mətninin sonu)

## GİRİŞ VƏ ŞƏRHLƏRİN YAZILMASI ZAMANI İSTİFADƏ EDİLMİŞ QAYNAQLAR VƏ ƏDƏBİYYAT

Azərbaycan dilində:


Abbaslı M. Şah İsmayıl Xətainin ömür yolu miniatürlərdə. Bakı, 1981.

Ağayev R.Ə. Azərbaycan və Mərkəzi Asiya dövlətlərinin qarşılıqlı münasibətləri (XV-XVI əsrlər). Bakı, 2004.

Aşurbəyli S.B. Şirvanşahlar dövləti (VI-XVI əsrlər). Bakı, 2006.

Azərbaycan Sovet Ensiklopediyası (on cilddə). Baş redaktor: C.B.Quliyev. Bakı, 1976-1987.

Azərbaycan tarixi üzrə qaynaqlar (tərtibatçı və redaktor: S.Əliyarlı). Bakı, 2007.

Babayev A.M. Azərbaycan klassik ədəbiyyatında işlədilən adların və terminlərin şərhi. Bakı, 1993.

Bayramlı Z.H. Azərbaycan Səfəvi dövlətinin quruluşu və idarə olunmasında türk qızılbaş əyanlarının rolu. Bakı, 2015.

Bayramlı Z.H. Azərbaycan Səfəvilər dövlətinin quruluşu və idarə sistemi. Bakı, 2006.

Bayramlı Z.H. Səfəvi dövlətinin idarə quruluşunda xüləfa institutunun yeri // BDU-nun Xəbərləri (humanitar elmlər seriyası). Bakı, 2004, № 2, s.165-174.

Bünyadov Z.M. Azərbaycan VII-IX əsrlərdə. Bakı, 1989.

Cəfiyev T.R. Azərbaycan feodal dövlətləri XV-XVI əsrin I rübündə (Xoca Sədəddin Əfəndinin "Tacüt-təvarix" əsəri əsasında). Tarix elmləri namizədi alimlik dərəcəsi almaq üçün təqdim olunan dissertasiyanın avtoreferatı. Bakı, 2007.

Ciddi H.Ə. Gülüstan qalası. Bakı, 1967.

Əbdürrəşid əl-Bakuvi. Kitab təlxis əl-asar və əcaib əl-məlik əl-qəhhar (Abidələrin xülasəsi və qüdrətli hökmdarların möcüzələri). Ərəbcədən tərcüməsi, müqəddimə və şərhləri Z.M.Bünyadovundur. Bakı, 1992.

Əbu-Bəkr Tehrani. Kitabi-Diyarbəkriyyə (Həsən bəy Ağqoyunlunun, onun sələflərinin tarixi və Qaraqoyunlu və Cığatay tarixindən ona aid olanlar). Fars dilindən tərcümə edən, ön söz, şərhlər və göstəricilərin müəllifi: R.Şükürova. Bakı, 1998.

Əbülqasim Firdovsi. Şahnamə. Tərcümə edəni: M.Əlizadə. Bakı, 1987.

Əfəndiyev O.Ə. Azərbaycan Səfəvilər dövləti. Bakı, 2007.

Əfəndiyev O.Ə. Salnaməçi Bicən Şah İsmayıl Xətai haqqında // Şah İsmayıl Xətai (məqalələr toplusu). Bakı, 1988, s.17-28.

Əfəndiyev O.Ə. Venesiyalılar Şah I Təhmasibin sarayında (Mikele Membre ve Vinçenso Alessandri). Bakı, 2005.

Əliyeva R. və d. Azərbaycan toponimlərinin ensiklopedik lüğəti. I-II c. Bakı, 2007.

Ərəb və fars sözləri lüğəti. Redaksiya heyəti: B.T.Abdullyev, Ə.Ə.Orucov, Y.Z.Şirvani. Bakı, 1985.

Əzimli D.M. Azərbaycanın Qərbi Avropa ölkələri ilə ticarət əlaqələri və Türkiyə (XV əsrin II yarısı – XVII əsrin I yarısı). Tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı. Bakı, 2010.

Fərzəlibəyli Ş.F. Azərbaycan və Osmanlı imperiyası (XV-XVI əsrlər). Bakı, 1995.

Fərzəliyev Ş.F. Azərbaycan XV-XVI əsrlərdə (Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri üzrə). Bakı, 1983.

Fərzəliyev Ş.F. Səfəvi hökmdarı I Şah Təhmasibin qızı Pərixan xanımın həyatı və fəaliyyəti barədə bəzi məlumatlar // AMEA Tarix İnstitutunun Elmi Əsərləri. XIX c. Bakı, 2007, s.25-46.

Gəncə-Qarabağ əyalətinin icmal dəftəri (layihənin rəhbəri və ön sözün müəllifi: Y.M.Mahmudov; tərtibçi: T.H.Nəcəfli). Bakı, 2010.

Həsən Mahmud oğlu Bayati. Cami-Cəm-ayin. Hazırlayan: İ.Osmanlı. Bakı, 2011.

Xacə Zeynalabidin Əli Əbdi bəy Şirazi. Təkmilətül-əxbar (Səfəvi dövrü – Şah İsmayıl və Şah Təhmasib dövrlərinin tarixi). Fars dilindən tərcümə, müqəddimə və şərhlər: Ə.Rəhimli. Bakı, 1996.

İbrahim Rəhimizadə Hərimi. Osmanlı qoşunlarının Azərbaycana yürüşləri (XVI əsrin sonu). Nəşrə hazırlayan, ön sözün və şərhlərin müəllifi: R.Şeyxzamanlı. Bakı, 2007.

İsgəndər bəy Münşi Türkman. Tarix-i aləmara-yi Abbasi. I cild. Farscadan tərcümənin, ön sözün, şərhlərin və göstəricilərin müəllifləri: O.Ə.Əfəndiyev və N.S.Musalı. Bakı, 2009.

İsgəndər bəy Münşi Türkman. Dünyanı bəzəyən Abbasın tarixi (Layihənin rəhbəri, redaktor və ön sözün müəllifi: Y.Mahmudov; Fars dilindən çevirən: Ş.Fərzəliyev). I-II cildlər. Bakı, 2011-2015.

İsmayıl C.C. Osmanlı tarixçisi Hüseynin "Bədayə-ül-vəqayə" əsəri Azərbaycan tarixinin mənbəyi kimi (XV-XVI əsrin I yarısı). Tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı. Bakı, 2012.

Qasımov X.S. Orta əsrlərdə Azərbaycan mədəniyyəti. Bakı, 2008.

Qızılbaşlar tarixi ("Tarix-e qezelbaşan"). Fars dilindən tərcümə və şərhlər M.Məhəmmədinindir. Bakı, 1993.

Quliyev A. Azərbaycanın görkəmli səyyah və alimi Hacı Zeynalabdin Şirvani. Bakı, 1964.

Quliyev Ə.S. XVI əsrin ortalarında Azərbaycan Səfəvilər dövlətinin ictimai-siyasi vəziyyəti (Mikel Membrenin "Səyahətnamə"si əsasında). Bakı, 2011.

Qurani-Kərim (ərəb dilindən tərcümə edənlər: Z.Bünyadov və V.Məmmədəliyev). Bakı, 1992.

Makulu P. Ədəbi məlumat cədvəli. Bakı, 1962.

Masse A. İslam: tarixi oçerk (ruscadan tərcümə edənlər: C.Cabbarov və A.Ələsgərov). Bakı, 1991.

Metsopski F. Teymurləngin və onun xələflərinin tarixi. Bakı, 1957.

Məmmədova Ş.K. "Xülasət ət-təvarix" Azərbaycan tarixinin mənbəyi kimi. Bakı, 1991.

Mirəhmədov Ə.M. Ədəbiyyatşünaslıq: ensiklopedik lüğət. Bakı, 1998.

Musalı N.S. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında). Bakı, 2011.

Musəvi T.M. Bakı tarixinə dair orta əsr sənədləri. Bakı, 1967.

Musəvi T.M. Orta əsr Azərbaycan tarixinə dair fars dilində yazılmış sənədlər. Bakı, 1965.

Musəvi T.M. Orta əsr Azərbaycan tarixinə dair farsdilli sənədlər (XVI-XVIII əsrlər). Bakı, 1977.

Naxçıvan Ensiklopediyası. I c. Naxçıvan, 2005.

Nemət M.S. Azərbaycanda pirlər. Bakı, 1992.

Nemətova M.S. XIV-XVI əsr Şirvan tarixinin öyrənilməsinə dair (epiqrafik abidələr əsasında). Bakı, 1959.

Nəcəfli T.H.. Azərbaycan Qaraqoyunlu və Ağqoyunlu dövlətləri müasir Türkiyə tarixşünaslığında. Bakı, 2012.

Nəcəfli T.H. Səfəvi – Osmanlı münasibətləri (Türkiyə tarixşünaslığında). Bakı, 2015.

Nəcəfzadə A.İ. Azərbaycan çalğı alətlərinin izahlı lüğəti. Bakı, 2004.

Nəcəfzadə A.İ. Azərbaycan idiofonlu çalğı alətləri. Bakı, 2010.

Nəsirli M.N., Məmmədov R.A. "Gələsən-Görəsən" qalası haqqında // Azərbaycan Tarixi Muzeyinin Əsərləri. VI c. Bakı, 1961.

Onullahi S.M. Azərbaycan dilində daha dörd sənəd // "Ədəbiyyat və incəsənət" qəzeti, 22.06.1990.

Onullahi S.M. XIII-XVII əsrlərdə Təbriz şəhəri (sosial-iqtisadi tarixi). Bakı, 1982.

Onullahi S.M., Həsənov A.Q. Qaraqoyunluların, Səfəvi hökmdarları və türk sultanlarının azərbaycanca beş yeni sənədi haqqında // ADU-nun Elmi əsərləri (tarix və fəlsəfə seriyası). Bakı, 1977, No. 1.

Onullahi S.M., Həsənov A.Q. Səfəvi hökmdarlarının daha iki naməlum məktubu haqqında (Azərbaycan dilində dövlətlərarası yazışma tarixindən) // ADU-nun Elmi əsərləri (tarix və fəlsəfə seriyası). Bakı, 1974, No.4.

Piriyev V.Z. Azərbaycan XIII-XIV əsrlərdə. Bakı, 2003.

Selaniki Mustafa Əfəndi. Tarixi-Selaniki (1563-1600-cü illər). Azərbaycan və qonşu ölkələrin tarixinə dair iqtibaslar (Osmanlı dilindən tərcümə edəni: Z.Bünyadov). Bakı, 1992.

Solakzadə Mehmed. Tarix: Azərbaycan tarixinə dair iqtibaslar (türk dilindən tərcümə edəni: Z.Bünyadov). Bakı, 1992.

Sultanov M. Əlyazmaları kataloqu (Azərbaycan SSR EA Respublika Əlyazmaları Fondu). I cild (tarix, coğrafiya, ədəbiyyat nəzəriyyəsi, təzkirələr, bədii ədəbiyyat və münşəat). Bakı, 1963.

Sümər F. Oğuzlar: tarixləri, boy təşkilatı, dastanları (türk dilindən tərcümə edəni: Ramiz Əsgər). Bakı, 1992.

Şah İsmayıl Səfəvi. Tarixi-diplomatik sənədlər toplusu (R.Mehdiyevin redaktəsi ilə). Bakı, 2014.

Şah Təhmasibin təzkirəsi (fars dilindən tərcümə və müqəddimə Ə.Rəhimovundur). Bakı, 1996.

Şərəfəddin Əli Yəzdi. Zəfərnamə (Azərbaycan tarixinə dair seçmələr). Fars dilindən tərcümə, ön söz və izahlar V.Piriyevindir. Bakı, 1996.

Şükürova R. Əbu Bəkr Tehrani və onun "Kitab-i Diyarbəkriyyə" əsəri. İstanbul, 2006.

Tərbiyət M. Danişməndani-Azərbaycan: Azərbaycanın görkəmli elm, sənət adamları (fars dilindən tərcümə edənlər: İ.Şəms, Q.Kəndli). Bakı, 1987.

Yusifov Y. Qədim Şərq tarixi. Bakı, 1993.

Zərinəzadə H.H. Fars dilində Azərbaycan sözləri (Səfəvilər dövrü). Bakı, 1962

Zühuri-dövləti-Səfəviyan (ön söz, transfoneliterasiya, tərcümə, şərhlər və göstəricilər: N.S.Musalı). Bakı, 2013.

Türk dilində:

Abbaslı M. Safevîler'in kökenine dair // Türk Tarih Kurumu (TTK), "Belleten", sayı: 158, Ankara, 1976, s.287-329.

Açıkel A. Rum eyaleti // Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi (TDVİA), cilt: 35, yıl: 2008, s.225-226.

Aka İ. Mirza Şahruh ve zamanı (1405-1447). Ankara, 1994.

Ali-Şir Nevayi. Mecalisün-Nefayis. Hazırlayan: K.Eraslan. I-II. c. Ankara, 2001.

Alptekin C. Artuklular // TDVİA, cilt: 3, yıl: 1991, s.415-418.

Arayancan A.A. Karakoyunlu hükümdarlarından Cihanşah ve dönemi. Doktora tezi. Ankara Üniversitesi Sosyal Bilimler Enstitüsü, 2010.

Âşık Paşazade. Osmanoğullarının tarihi. Hazırlayanlar: Kemal Yavuz, M.A.Yekta Saraç. İstanbul, 2003.

Buzpınar Ş.T. Nakîbüleşrâf // TDVİA, cilt: 32, yıl: 2006, s.322-324.

Cevad A. Memalik-i Osmaniye'nin tarih ve coğrafya lugati. I c. İstanbul, 1313.

Çelenk M. XVI. ve XVII. yüzyıllarda Safevî Şiîliği. Doktora tezi. Bursa: Uludağ Üniversitesi Sosyal Bilimler Enstitüsü, 2005.

Dedeyev B. XV. yüzyılın ikinci yarısında Osmanlı Devleti – Azerbaycan ilişkileri. Konya: Selçuk Üniversitesi Sosyal Bilimler Enstitüsü, 2004.

Demirci K, Uzun M. Dahhâk // TDVİA, cilt: 8, yıl: 1993, s.408-409.

Demirkent I. İstanbul // TDVİA, cilt: 23, yıl: 2001, s.205-212.

Devellioğlu F. Osmanlıca-Türkçe Ansiklopedik Lugat. 24. baskı. Ankara, 2007.

Doğuştan Günümüze Büyük İslam Tarihi. İlmî müşavir ve redaktör: H.D.Yıldız. IX. c. İstanbul, 1992.

Efendioğlu M. Şeyhayn // TDVİA, cilt: 39, yıl: 2010, s.80.

Efendiyev O, Musalı N. Târîh-i 'Âlem Ârâ-yi 'Abbasî isimli eserin Bakü yazmalarının önemine dair // Safevîler ve Şah İsmail. İstanbul, 2014, s.117-160.

Emecen F., Tanman M.B. Saruhanoğulları // TDVİA, cilt: 36, yıl: 2009, s.170-174.

Ergün A. Üç kitanin hakimi Kanuni Sultan Süleyman. İstanbul, 2009.

Ertürk M. Havz-ı Kevser // TDVİA, cilt: 16, yıl: 1997, s.546-549.

Eyice S. Çoban köprüsü // TDVİA, cilt: 8, yıl: 1993, s.350-351.

Hammer J.V. Osmanlı tarihi (çeviren: Mehmet Ata). I. cilt. İstanbul, 1991.

Harman Ö.F., Albayrak T. Eyyub // TDVİA, cilt: 12, yıl: 1995, s.16-17.

Harman Ö.F., Şener H.İ. Kârûn // TDVİA, cilt: 24, yıl: 2001, s.519-520.

Hasan-ı Rumlu. Ahsenü't-Tevârîh (çeviren: M.Öztürk). Ankara, 2006.

Hinz W. Uzun Hasan ve Şeyh Cüneyd (çev. T.Bıyıklıoğlu). Ankara, 1992.

Hüseynli Z. Farsça yazan Türk tarihçilerinin Türk tarihine yaklaşımları // I. Uluslararası Türklerde Tarih Bilinci ve Tarih Yazıcılığı Sempozyumu Bildiriler Kitabı. Zonguldak, 2015, s.221-228.

Javanshir B. İran'daki Türk boyları ve boy mensubu kişiler (Safevî dönemi – I Şah Tahmasp hâkimiyetinin sonuna kadar / 1576). Doktora tezi. İstanbul: Mimar Sinan Güzel Sanatlar Üniversitesi, 2007.

İlgürel M. Subaşı // TDVİA, cilt: 37, yıl: 2009, s.447-448.

Kâtip Çelebi. Tufetu'l-Kibâr fî Esfâri'l-Bihâr / Deniz savaşları hakkında büyüklere armağan. Yayına hazırlayanlar: S.Çakmakcıoğlu, Ç.Şan. İstanbul, 2007.

Kılıç R. Kanuni devri Osmanlı – İran münasebetleri (1520-1566). İstanbul, 2006.

Kırzıoğlu F. Osmanlıların Kafkas-ellerini fethi (1451-1590). Ankara, 1993.

Konukçu E. Hızır Han // TDVİA, cilt: 17, yıl: 1998, s.415-416.

Kurnaz C. Hüma // TDVİA, cilt: 18, yıl: 1998, s.478.

Kütükoğlu M. Tarih araştırmalarında usûl. İstanbul, 1991.

Mehmed Neşrî. Kitâb-ı Cihan-Nümâ. Yayınlayanlar: F.R.Unat, M.A.Köymen. I. c. Ankara, 1987.

Musalı N. Farsça kaynaklara göre Üsküdar'ın tarihi ve coğrafyası // VI. Uluslararası Üsküdar Sempozyumu. II. c. İstanbul, 2009, s.37-42.

Musalı N. Safevî kaynaklarına göre Tokat // Gaziosmanpaşa Üniversitesi Tokat Tarihi ve Kültürü Sempozyumu. Bildiriler. I. c. Tokat, 2015, s.563-577.

Okay M.O. Sihr-i Helâl // TDVİA, cilt: 37, yıl: 2009, s.172-173.

Osmanlı tarihi el kitabı. Editör: T.Gündüz. Ankara, 2013.

Öden Z.G. Karesioğulları // TDVİA, cilt: 24, yıl: 2001, s.488-489.

Özaydın A. İbn Mukle // TDVİA, cilt: 20, yıl: 1999, s.211-212.

Özek A. el-Keşşaf // TDVİA, cilt: 25, yıl: 2002, s.330-331.

Özcan A. Akıncı // TDVİA, cilt: 2, yıl: 1989, s.249-250.

Özcan A. Ulûfeciyân // TDVİA, cilt: 42, yıl: 2012, s.126-127.

Pala İ. Ansiklopedik divân şiiri sözlüğü. İstanbul, 2007.

Roux J.P. Türklerin tarihi: Pasifik'ten Akdeniz'e 2000 yıl (çevirenler: A.Kazancıgil, L.Arslan-Özcan). İstanbul, 2007.

Rumlu Hasan. Şah İsmail tarihi (Ahsenü't-Tevârîh). Çev. C.Cevan. Ankara, 2004.

Serin M. İbnü'l-Bevvâb // TDVİA, cilt: 20: yıl: 1999, s.534-535.

Sezen T. Osmanlı yer adları. Ankara, 2006.

Siddiqui İ.H. Kert // TDVİA, cilt: 25; yıl: 2002; s.297.

Sümer F. Kara Koyunlular: Başlangıçtan Cihan-Şah'a kadar. Ankara, 1992.

Sümer F. Karamanoğulları // TDVİA, cilt: 24, yıl: 2001, s.454-460.

Sümer F. Safevî Devletinin kuruluşu ve gelişmesinde Anadolu Türklerinin rolü. Ankara, 1999.

Sümer F. Türk devletleri tarihinde şahıs adları. I-II. c. İstanbul, 1999.

Şah İsmail Hatai külliyatı. Hazırlayanlar: B.Cavanşir, E.N.Necef. İstanbul, 2006.

Şıhıyeva S. Nesimî'nin biyografisinin yazılmasında metodolojik ilkeler // Mustafa İsen Adına Uluslararası Sempozyum: Klasik Türk Edebiyatında Biyografi (Bildiriler). Ankara, 2011, s.565-602.

Şükürov G. Safevîler'de av geleneğinin oluşumu ve I. Şah İsmail dönemi av merasimleri // Acta Turcica, yıl: 1, sayı: 1, Ocak 2009, s.56-71.

Tanyu H. Cûdî dağı // TDVİA, cilt: 8, yıl: 1993, s.79-80.

Taşağıl A. İnak // TDVİA, cilt: 22, yıl: 2000, s.255-256.

Taşğın A. Safevî – Osmanlı savaşından itibaren dinî söylemin siyasal propaganda aracı olarak kullanılması: Dede Kargın örneği // Türk Kültürü ve Hacı Bektaş Veli Dergisi, sayı: 49, Ankara, 2009, s.209-223.

Tursun Bey. Fatih'in Tarihi – Târih-i Ebü'l-Feth. Haz. A.Tezbaşar. Tercüman Yayınları.

Türkçe sözlük. Hazırlayanlar: Hasan Eren vd. I-II. c. Ankara, 1988.

Unat F.R. Hicri tarihleri Miladi tarihe çevirme kılavuzu. Ankara, 1988.

Uzunçarşılı İ.H. Osmanlı tarihi, I-II. c. Ankara, 1988.

Varlık M.Ç. Germiyanoğulları // TDVİA, cilt: 14, yıl: 1996, s.33-35.

Veliyeva Z. Safevî devlet teşkilatı: Tezkiretü'l-Mülük'e göre. Doktora tezi. Ankara Üniversıtesi Sosyal Bilimler Enstitüsü, 2007.

Yakupoğlu C. İsfendiyar Bey ve zamanı. Yüksek lisans tezi. Ankara: Gazi Üniversitesi Sosyal Bilimler Enstitüsü, 1999.

Yaman A. Allahçılar. İstanbul, 2006

Yaşaroğlu K. Kafdağı // TDVİA, cilt: 24, yıl: 2001, s.144-145.

Yazıcı T, İpsirli M. Ferraş // TDVİA, cilt: 12, yıl: 1995, s.408-409.

Yınanç R. Dulkadir Beyliği. Ankara, 1989.

Yücel Y. Candaroğulları // TDVİA, cilt: 7, yıl: 1993, s.146-149.

Rus dilində:

Агаев Ю., Ахмедов С. Ак-коюнлу – османская война, 1472-1473 гг. Баку, 2006.

Али-заде А.А. Социально-экономическая и политическая история Азербайджана в XIII-XIV вв. Баку, 1956.

Ашурбейли С.Б. История города Баку (период средневековья). Баку, 1992.

Бакиханов А. Гюлистани – Ирам (редакция, комментарии, примечания и указатели З.М.Буниятова). Баку, 1991.

Бартольд В.В. Иран: исторический обзор. Ташкент, 1926.

Байрамов З.Г. Местное и городское управление в Азербайджане в системе государства Сефевидов. Автореферат диссертации на соискание ученой степени кандидата исторических наук. Баку, 1985.

Бобров Л.А., Сальников А.В. Тактический прием «тулгама» в военном искусстве монголов в XIII в. // Былые годы: российский исторический журнал, 2015, том 38, № 4, с.786-797.

Босворт К.Э. Мусульманские династии: справочник по хронологии и генеологии (перевод с английского и примечания П.А.Грязневича). Москва, 1971.

Вахушти Багратиони. История царства грузинского (перевел, снабдил предисловием, словарями и указателем Н.Т.Накашидзе). Тбилиси, 1976.

Вильданова А.Б. Подлинник бухарского трактата о чинах и званиях // Письменные памятники Востока. Москва, 1970, с.40-44.

Гейдаров М.Х. Города и городское ремесло Азербайджана в XIII – XVII вв. Баку, 1982.

Гейдаров М.Х. Социально-экономические отношения и ремесленные организации в городах Азербайджана в XIII-XVII вв. Баку, 1987.

Гейдаров М.Х. Торговля и торговые связи Азербайджана в позднем средневековье. Баку, 1999.

Губоглу М. Турецкий источник 1740 г. о Валахии, Молдавии и Украине // Восточные источники по истории народов юго-восточной и центральной Европы. Том 1. Москва, 1964, с.134-153.

Гусейн Ф.А. Османо – сефевидская война 1578-1590 гг. (по материалам трудов османского летописца Ибрахима Рахимизаде). Баку, 2005.

Дашков С.Б. Императоры Византии. Москва, 1996.

Ибрагимов Дж.М. Феодальные государства на территории Азербайджана XV века. Баку, 1962.

Камалиддинов Ш.С. Историческая география Южного Согда и Тохаристана по арабоязычным источникам IX - начала XIII вв. Ташкент, 1996.

Карамзин Н.М. История государства российского. Том IX. Санкт-Петербург, 1821.

Книга Орудж-бека Байата – Дон Жуана Персидского (перевод с английского на русский О.А.Эфендиева и А.М.Фарзалиева). Баку, 1988.

Малик Шах-Хусайн Систани. Хроника воскрешения царей (Тарих-и ихйа ал-мулук). Перевел с персидского: Л.П.Смирнова. Москва, 2000.

Мамедов С.А. Азербайджан по источникам XV – первой половины XVIII вв. Баку, 1993.

Материалы по истории туркмен и Туркмении. Т. I-II. Москва – Ленинград, 1938-1939.

Махмудов Я.М. Взаимоотношения государств Ак-коюнлу и Сефевидов с западно-европейскими странами (вторая половина XV – начало XVII вв.). Баку, 1991.

Мелитаури К.Н. Строительство и архитектура Вардзии. Тбилиси, 1975.

Мефтах Э. Историческая география Мургаба-Мерва и Мерверруда // Мерв-наме – Книга о Мерве. Ашкабат, 2003, с.63-127.

Мирза Мухаммад Хайдар. Тарих-и Рашиди (перевод с персидского А.Урунбаева, Р.Джалиловой и Л.Епифановой). Ташкент, 1996.

Мустафаев Ш.М. Восточная Анатолия: от Ак-коюнлу к Османской империи. Москва, 1994.

Мустафаев Ш.М. Тимуридское посольство в Китай и его описание на азербайджанском языке согласно рукописи XV в. // Известия НАН Азербайджана. Серия общественных наук. Баку, 2015, № 3, с.98-115

Наджафов Г. Каталог персидских рукописей (сочинения по истории и географии). Баку, 2013.

Нейматова М.С. Мемориальные памятники Азербайджана (XII-XIX вв.). Баку, 1981.

Парсадан Горгиджанидзе. История Грузии (перевод с грузинского Р.К.Кикнадзе и В.С.Путуридзе). Тбилиси, 1990.

«Парижская хроника». Перевел с грузинского Г.Г.Аласания. Тбилиси, 1991.

Петрушевский И.П. Восстание ремесленников и городской бедноты в Тебризе в 1571-1573 гг. // Сборник статей по истории Азербайджана (ССИА). Вып. I. Баку, 1949, с.214-224.

Петрушевский И.П. Государства Азербайджана в XV веке // ССИА. Вып. I. Баку, 1949, с.153-213.

Петрушевский И.П. Иранские источники по истории Азербайджана (XVI-XVIII вв.) // ССИА. Вып. I. Баку, 1949, с.299-310.

Петрушевский И.П. Ислам в Иране в VII-XV вв. Ленинград, 1966.

Петрушевский И.П. Очерки по истории феодальных отношений в Азербайджане и Армении в XVI – начале XIX вв. Ленинград, 1949.

Печеви Ибрахим Эфенди. История (Извлечения по истории Азербайджана и сопредельных стран и областей периода 1520-1640 гг.). Перевод с турецкого языка и примечания З.М.Буниятова. Баку, 1988.

Путешественники об Азербайджане. Т. 1. Составитель З.И.Ямполский; под ред. Э.М.Шахмалыева. Баку, 1961.

Раджабли А.М. Монетное дело в Сефевидском государстве (XVI – начало XVIII вв.). Автореферат диссертации на соискание ученой степени кандидата исторических наук. Баку, 1963.

Рахмани А.А. «Тарих-и алам ара-йи Аббаси» как источник по истории Азербайджана. Баку, 1960.

Стори Ч.А. Персидская литература: био-библиографический обзор в трех частьях (перевел с английского, переработал и дополнил Ю.Э.Брегель). Москва, 1972.

Советская историческая енциклопедия (СИЭ) в 16-ти томах. Москва, 1961-1976.

Фазлаллах ибн Рузбихан Исфахани. Михман-наме-йи Бухара. Пер. Р.П.Джалиловой. Москва, 1976.

Фазлуллах ибн-Рузбихан Хунджи. Тарих-и алам ара-йи Амини (под редакцией З.М.Буниятова и О.А.Эфендиева). Баку, 1987.

Фарзалиев А.М., Мамедова Р.М. Сефевиды и Великие Моголы в мусульманской дипломатике. Санкт-Петербург, 2004.

Фарзалиев Ш.Ф. Сочинение Хасан-бека Румлу «Ахсан ат-таварих» как источник по истории Азербайджана. Автореферат диссертации на соискание ученой степени кандидата исторических наук. Баку, 1974.

Фасих Хавафи. Муджмал-и Фасихи / Фасихов свод. Пер., предисл., примеч. и указ. Д.Ю.Юсуповой. Ташкент, 1980.

Хамдаллах Казвини. Нузхат ал-Кулуб: материалы по Азербайджану (пер. З.М.Буниятова и И.П.Петрушевского). Баку, 1983.

Цыбульский В.В. Современные календари стран Ближнего и Среднего Востока. Москва, 1964.

Шараф-хан Бидлиси. Шараф-наме (перевод, предисловие, примечания и приложения Е.И.Васильевой). Т. II. Москва, 1976.

Шахмалиев Э.М. Из истории торговой политики европейских держав на Переднем Востоке в XVI в. Автореферат диссертации на соискание ученой степени доктора исторических наук. Баку, 1958.

Экаев О. Туркменистан и туркмены в конце XV – в первой половине XVI века (по данным «Алам ара-и Сефеви»). Ашхабад, 1981.

Эфендиев О.А. Азербайджанское государство Сефевидов в XVI веке. Баку, 1981.

Эфендиев О.А. Институт «сойургал» и централистическая политика правителей Аккоюнлу и первых Сефевидов // Формы феодальной земельной собственности и владения на Ближнем и Среднем Востоке. Москва, 1979, с.168-175.

Эфендиев О.А. «Китаб-и Дийарбакрийе» Абу Бакра Тихрани как исторический источник // Источниковедческие разыскания – 1982. Тбилиси, 1985, с.112-118.

Эфендиев О.А. Образование Азербайджанского государства Сефевидов в начале XVI века. Баку, 1961.

Юдахин К.К. Киргизско-русский словарь. Книга I. Фрунзе, 1985.

Fars dilində:

A Chronilcle of the Early Safawis Being the Ahsanu't-Tawarikh of Hasan-i Rumlu. Vol. I (Persian text). Edited by C.N.Seddon. Baroda, 1931.

Cahanbəxş F. Zindeginameyi-şe'rü-şairani-irani. Tehran, 1384.

Cahangüşayi-xaqan (Tarixi-Şah İsmayıl). Müqəddimə və peyvəstha: A.Müztərr. İslamabad, 1986.

Cəmkərani Ə.R. "Be mahi-tir kangəh bud nisan": Bərrəsi və nəqdi-beyti əz Xaqani dər şüruhi-müxtəlif // Peyami-Bəharistan, VI / 22, Zemestani-1392, s.11-33.

Əliməhəmmədi Z. Həsən bəy Rumlu: müvərrixi ba mənsəbi-qurçigəri // Nameyi-tarixpəjuhan, 1388 (payiz), No. 19, s.118-141.

Fəlsəfi N. Zindeganiyi-Şah Abbasi-Əvvəl. I c. Tehran, 1334.

Həsən bəy Rumlu. Əhsənüt-təvarix (təshih və təhşiyə: Ə.Nəvai). I-III c. Tehran, 1389.

Həsən bəy Rumlu. Əhsənüt-təvarix. AMEA M.Füzuli adına Əlyazmalar İnstitutu, B-1696.

Həsən bəy Rumlu. Əhsənüt-təvarix. AMEA M.Füzuli adına Əlyazmalar İnstitutu, S-435.

Xiyavi S.N. Xiyav: qomşodeyi-tarix. Tehran, 1380.

Kəmaləddin Əbdürrəzzaq Səmərqəndi. Mətləüs-səədeyn və məcməül-bəhreyn. Ba ehtemami: Ə.Nəvai. IV c. Tehran, 1383.

Mirzə Səmia. Təzkirətül-müluk (be kuşişi: S.M.Dəbirseyaqi). Tehran, 1368.

Müin M. Fərhəngi-farsi. I-VI c. Tehran, 1342-1352.

Sazmani-idariyi-hokuməti-Səfəvi ya təliqati-Minorski bər "Təzkirətül-müluk", tərcümeyi: M.Rəcəbniya. Tehran, 1368.

Sərvər Q. Tarixi-Şah İsmail (tərcümə: M.B.Aram və A.Qəffarifərd). Tehran, 1374.

Şeyx Hüseyn pesəri-Abdal Pirzadeyi-Zahidi. Silsilətün-nəsəbi-Səfəviyyə. Berlin, 1343.

Şeyx Müfid Davər. Təzkireyi-miratül-füsəha (ba təshihü təkmilü əfzudehayi: M.Tavusi). Şiraz, 1371.

İngilis dilində:

A Chronilcle of the Early Safawis Being the Ahsanu't-Tawarikh of Hasan-i Rumlu. Vol. 2 (English Translation). Translated by C.N.Seddon. Baroda, 1934.

Browne E.G. A History of Persian Literature in The Modern Times (A.D. 1500-1924). Cambridge, 1924.

Davidson O.M. Haft Kvan // Encyclopaedia Iranica, vol. XI, fasc. 5, New York, 2003, p.516-519.

K.Ghereghlou. Ḥayâti Tabrizi (Qâsem Beg) // Encyclopædia Iranica, online edition, 2016, available at http://www.iranicaonline.org/articles/hayati-tabrizi (accessed on 28 June 2016).

Minorsky V.F. A Mongol Decree of 720/1320 to the Family of Shaykh Zahid // Bulletin of the School of Oriental and African Studies (BSOAS). Vol. 16, part 3. London, 1954, p. 515-527.

Minorsky V.F. "Tadhkirat al-Muluk": A Manual of Safavid Administration circa 1137/1725. London, 1943.

Safa Z. Banâ'î Heravî // Encyclopaedia Iranica, vol. III, New York,1989.

Savory R.M. Some Reflections on Totalitarian Tendencies in the Safavid State // Der Islam, band. 53, Berlin, 1976, p.226-241.

Savory R.M. The Consolidation of Safavid Power in Persia // Der Islam, band. 41, Berlin, 1965, p.71-94.

Savory R.M. The Office of Khalifat al-Khulafa under the Safawids // Journal of the American Oriental Society, vol. 85, New-Haven, 1965, p.497-502.

Savory R.M. The Principial Offices of the Safavid State during the Reign of Ismail I // BSOAS, vol. 23, London, 1960, p.91-105.

Seddon C.N. Hasan-i Rumlu's Ahsanu't-tawárikh // Journal of the Royal Asiatic Society of Great Britain and Ireland, No. 2 (Apr., 1927), p.307-313.

Stanfield-Johnson R. The Tabarra'iyan and the Early Safavids // Iranian Studies; March 2004; Volume 37, No. 1, p.47 -71.

Alman dilində:

Dorn B. Muhammedanische Quellen zur Geschichte der südlichen Küstenländer des Kaspischen Meeres. Theil IV. St. Petersburg, 1858, s.375-431.

İnternet resursları:

http://www.aghabozorg.ir/search.aspx
http://www.loghatnaameh.com/
https://maps.google.com
http://www.ttk.gov.tr/index.php?Page=Sayfa&No=385



“Əhsənüt-təvarix”in AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda mühafizə olunan B-1696 şifrəli nüsxəsindən bir fraqment